Baş Məsləhətçi:

**Professor Şeyxülislam A. H. Paşazadə**

Nəşrə hazırlayan:

**t.f.d. Abbas Qurbanov**

Transliterasiya:

**Əli Fərhadov**

Redaktorlar:

**Hacı Salman Musayev**
**Hacı Fuad Nurullah**
**i.f.d. Əhməd Niyazov**
**f.f.d. Sıracəddin Hacı**

Bədii tərtibat:

**Zaur Orucov**

Dizaynerlər:

**Ülvi Məmmədov**
**Əflatun Məmmədov**
**Sərxan İsgəndərov**

ISBN: 978-9952-82-21-9-9

# Kəşfül-Həqayiq

an-Nukətil-Ayati vəd-Dəqaiq

(Ayələrin Məna və İncəlikləriylə Həqiqətlərinin Açıqlanması)

Azərbaycan türkcəsində Qurani-Şərifin təfsiri

## II cild


**Müəllif və naşiri:**

Hacı Mirməhəmməd Kərim Mircəfər əl-Ələvi əl-Hüseyni əl-Musəvi
əl-Bakuvi

Bakı şəhərinin qazısı və quberniya məclisinin sədri



15 şaban 1322-ci il

7 yanvar 1904-cü ildə Tiflisdə senzura icazəsi ilə
“Kaspi” qəzetinin Buxariyyə mətbəəsində çap olunub.

## Bismillahir-Rəhmanir-Rəhim
# MÜQƏDDİMƏ

Aləmlərin yaradıcısı, təqdir və təyin edəni əlahəzrət izzət və cəlal sahibi Allah-Təalanın müqəddəs pak zatına həmd-səna olsun ki, qaranlıq torpaqdan əql və kamal nuruyla aydınlanıb, elm və sənətlə süslənən insanı yoxluqdan dünyaya gətirib məxluqların ən fəzilətlisi edibdir. İnsanların arasından xüsusi imtiyaz ilə seçilən, bəşəriyyət mərtəbəsinin ən yüksək dərəcəsinə yetişib özlərindən aşağı dərəcədə olan şəxsləri zahiri və mənəvi kamilliyə hidayət etməyə qabil olan peyğəmbərləri seçib, xalqın din və dünya işlərində nicat tapıb hidayət yoluna qovuşmalarından ötrü onları ehkam və şəriət sahibi etdi. O cənabların müqəddəs pak ruhlarına Allah-Təaladan mütləq və daimi salam və rəhmət olsun. Xüsusən, insan nəslinin, peyğəmbərlər silsiləsinin rəhbəri, son peyğəmbər, hidayət yolunun padşahı, övliyalar rəisi, İbrahim Xəlilüllahın nəslindən olub, yerin və səmaların həmd etdiyi, Allah tərəfindən dəstəklənən böyük və möhtərəm peyğəmbər Məhəmməd ibn Abdullah ibn Əbdülmüttəlibə salavat və salam olsun, o cənabın Quran ayəsi ilə pak edilən əhli-beytinə və səhabələrinə gecə-gündüz dua və sonsuz rəhmət olsun.

İnsan nəslinin yaradılmasında əsl məqsəd onları fəzilət, kamal, elm və sənət sahibi etmək olub, izzət və əzəmət sahibi Allah-Təaladan nazil olan Qurani-Şərifin səhifələrindəki: **“Biz Adəm övladını şərəfli etdik”** (İsra, 70) ayəsi qiyamətə kimi oxunacaqdır. Hərçənd Adəm övladının cismi zahirdə şəffaf olmayan maddədən yaradılıbdır, amma məsələnin batininə dürüst diqqət edib fikir verəndə Allah-Təalanın həmin maddənin arasına elm, sənət öyrənməyə təşviq edən fövqəladə bir güc qoyduğu məlum olur. Qatı və incə cisimlərin heç biri elm və sənətdə in-

san mərtəbəsinə yetişə bilmədiyi üçün Qurandakı **"Biz əmanəti göylərə və yerə təklif etdik..."** ayəsi (Əhzab, 72) məhz Adəm övladının haqqında nazil olub, məşhur peyğəmbərimiz Məhəmməd ibn Abdullahın möcüzəli bəyanı ilə ifadə edildi. Hər dövrdə və hər bir zamanda peyğəmbərlər və övliyalar Adəm övladını cəhalətdən elmə, zəlalətdən hidayət tərəfinə dəvət edibdir. Hər bir fəsadın və zəlalətin başı cəhalətdir. Hansı millətin arasında cəhalət yayılarsa, o millətin arasında hər cür fəsad, zülm və qəbih əməllər rəvac tapar. Keçmiş dövrlərdə olan millətlərdən meydana gələn qəbih əməllərin hamısının səbəbi cəhalət deyilmi? İslam ümmətinin ən işıqlı və parlaq zamanlarında bütün digər millətlərin arasında qurtulmuş ümmət olan müsəlmanlar elm və sənətlə süslənib, hər bir fənnə agah olmaq səbəbilə digər millətlərdən öndə olub, hamısına rəhbərlik edirdilər. Bu əmr Qurani-Şərifdə və hədislərdə əmr olunan ittihad və ittifaqın səbəbinə meydana gəlmişdi. İslam ittifaqının ən möhkəm zamanlarında onun müvəffəqiyyəti bütün bəşər aləmində sabit və bərqərar olmuşdu. Ən uzaq şərqdə Çinin paytaxtı olan Pekin şəhərində Əbu Kəbşə məscidi və ən uzaq qərbdə Əndəlüs məmləkətindəki əl-Hamra sarayı islamın fövqəladə müvəffəqiyyətinə işarə etməzmi? Amma bu müvəffəqiyyət hara gedib? Bu ixtilaf nədən yaranıb? İslam qanunlarının yaradıcısı olan uca peyğəmbərin möcüzəvi əmrlərinə nə qədər ki islam ümməti tərəfindən riayət edilirdi, müsəlmanlarda ecazkar bir müvəffəqiyyət, elm, sənət, fəzilət, kamal müşahidə olunurdu. Elə ki ittihad ixtilafa, ittifaq nifaqa çevrilib, müvəffəqiyyət süqut etməyə başladı, elm və sənət cəhalətə, fəzilət və kamal axmaqlıq və rəzalətə çevrilib, günbəgün müsəlmanların arasında cəhalət yayılmağa başladı.

İttihadı, dinini sevən xeyirxah şəxslər bu sözlərdən sıxılarlar. Qayıdaq bugünkü halımızdan bir qədər danışaq. Bugünkü gündə və bu xeyirli işlər dövründə əksər islam ölkələrində müsəlmanlar arasında elm və sənətə qəribə meyil və rəğbət hiss olunur, hər bir müsəlman milləti öz dilinin yayılmasına çalışıb öz ana dillərində elm, sənət öyrənməyə meyil və rəğbət edirlər. Xüsusən, türk dilində danışan müsəlman vətənpərvər şəxslərin öz ana dilində elmi yaymada fövqəladə qeyrətli olduqları hiss olunur. Hər bir vətənpərvər qeyrətli alim (حب الوطن من الإيمان) "Vətən

sevgisi imandandır” (Acluni, Kəşful-Xəfa, I/138) hədisinin şərtincə öz millləti və insanlıq aləmi üçün öz ixtisas sahəsində bir məqalə, ya da bir kitab yazıb nəşr edibdir. Elm, fənn sahibi olmayıb, lakin sərvət və var-dövləti ilə məşhur olan bəzi zənginlər də öz əziz vətənlərinə, insanlığa və islamiyyətə xidmət etməkdən ötrü o kitabların əksəriyyətini gözəl şəkildə bəzəyərək nəşr edir, millət arasında yayırlar ki, bütün islam aləminə də mənfəət versin və bu səbəbdən bu zəmanəyə xeyriyyəçilik dövrü demək daha doğrudur. Bu səbəbdən mən həqir də ərəb dilinə və elminə sahib olduğum üçün pak qardaşlarıma töhfə etmək üçün Qurani-Şərifin təfsirindən daha əziz bir hədiyyə tapmadım. Necə ki Hz. Yusifin dostlarından biri onun hüzuruna gələndə, Yusif ondan soruşdu ki, mənə nə töhfə gətiribsən? O şəxs əlini cibinə salıb, oradan bir güzgü çıxarıb Yusifə təqdim etdi. O cənab buyurdu: “Bu necə töhfədir?” O şəxs dedi: “Hərçənd mən çox fikirləşdim, amma sənin misilsiz camalından daha yaxşı bir şey tapa bilmədim ki, sənə töhfə gətirim, aynanı sənin hüzuruna gətirdim ki, ona baxıb öz camalından ləzzət alasan”. Bu səbəbdən Qurani-Şərifin təfsirinə sürətlə başlayıb, bu acizanə əsəri, ecazkar və sonsuz fəsahət və bəlağətə şamil olan mübarək kəlamın təfsirini yazıb, islam ümmətindən ötrü əbədi bir xatirə etdim. Yusif öz camalını aynada görən kimi, islam ümməti də öz xeyir və şər əməllərini, gözəl və qəbih xüsusiyyətlərini ilahi kəlamın aynasında görüb, düşünüb, birincini artırmağa, ikincini də tərk etməyə qeyrət etsinlər.

Allah-Təala cahil bir xalqın içindən savadsız bir şəxsi seçib İslam şəriətinin sahibi və peyğəmbər olaraq vəzifələndirdi. Heç bir elmə sahib olmadığı halda, hikmət elmini, zahiri və mənəvi kamilliyi ona bəxş edib, insanların arasından onu alim etdi, “وَمَا أَرْسَلْنَاكَ إِلَّا كَافَّةً لِّلنَّاسِ” (Ya Rəsulum!) **Biz səni** (təkcə öz qövmünə deyil) **bütün insanlara göndərdik.** (Səbə 34/28) ayəsi ilə o cənaba xitab etdi. Ta ki insanlar elmin necə uca olduğunu dərk edib, elmə meyil və rəğbət edib, bəlkə, hər bir şeydən öncə elm öyrənməyi özlərinə vacib saysınlar. İnsanın din və dünyasına, məişətinə lazım olan elmləri öyrənmək lazım və vacibdir, bu səbəbdən uşaqlıqdan elm öyrənməyə başlamaq lazımdır, lakin uşaqda ilk öncə heyvanlıq xüsusiyyəti üstün olduğundan elm öyrənməyə meyli olmayıb, ondan nifrət edər. Bu zaman onların atalarına,

himayədarlarına, himayədarı olmayan uşaqlardan ötrü bütün müsəlmanlara vacibdir ki, zorla, ya da xoş vədlər verməklə - hərçənd yalan da olsa, uşaqları elm öyrənməyə vadar etsinlər. Peyğəmbərlər xalqı bəzən qorxudub, bəzən də ümidləndirib, Allah-Təala tərəfinə dəvət etdikləri kimi, onlar da uşaqları o cür elm öyrənməyə vadar etsinlər. Peyğəmbərlərin dəvəti xalqı cəhalətdən xilas edib elm və aydınlıq aləminə çıxartmaqdan ötrüdür. Gərək atalar da peyğəmbərlərin bu metodunu qəbul edib, övladlarına müəllim olsunlar. Fərq buradadır ki, peyğəmbərlər vədlərində sadiq olub, həqiqətən, reallaşan hadisələri xəbər veriblər. Amma atalar övladlarına verdiyi vədlərdə yalançı olsalar da, o yalanın sonu bəyənildiyinə görə o yalandan ona heç bir zərər aid olmaz. Amma bizim islam ümməti peyğəmbərlər halqasının başı olan möhtərəm peyğəmbərimizə baxmayıb və ona tabe olmayıb, onun dili ilə bəyan edilən Qurani-Şərifin elm barəsindəki ayələrinə nəzər salmırlar. Əgər insanlarda elm öyrənmək qabiliyyəti olmasaydı, "وَلَقَدْ كَرَّمْنَا بَنِي آدَمَ" **Biz, Adəm övladını şərəfli və hörmətli elədik.** (İsra, 17/70) ayəsi onların haqqında nazil olmazdı, insanı uca dərəcələrə qovuşduran elmdir, insanı zəlalət vadisindən çıxarıb aydınlığa daxil edən elmdir, sahibini tay-tuşlarının arasından seçilib alim edən elmdir. Dünyada heç kimin dünya malı ilə fəxr etməsi caiz deyil, ancaq elm sahibi öz elmi ilə fəxr edə bilər. Həzrət Əli (ə.s), gövhər kimi olan mənzuməsində belə buyurubdur:

"مَا الْفَخْرُ إِلاَّ لِأَهْلِ الْعِلْمِ إِنَّهُمُ - علَى الْهُدَى لِمَنِ اسْتَهْدَى أَدِلاَّءُ" "Heç bir şəxsdən ötrü heç bir şeylə fəxr etmək caiz deyildir. Ancaq elm əhli öz elmləri ilə (fəxr edə bilər). Həqiqətən, elm əhli hidayət istəyən şəxslərdən ötrü hidayət tərəfinə dəlildir.

"قَدْرُ كُلِّ امْرِئٍ مَا كَانَ يُحْسِنُهُ - وَالْجَاهِلُونَ لِأَهْلِ الْعِلْمِ أَعْدَاءُ" Hər bir kişinin qədir-qiyməti, onun batinini gözəl əxlaqla süsləyən və o kişinin surətində təzahür edən şeyin səbəbi elmdir ki, insanı gözəl xüsusiyyətlərə sahib edər. Amma cahillər elm əhlinə düşməndirlər.

"فَفُزْ بِعِلْمٍ تَعِشْ حَيًّا بِهِ أَبَدًا - النَّاسُ مَوْتَى وَأَهْلُ الْعِلْمِ أَحْيَاءُ" Elm öyrənib, elmə sahib ol ki, o elmin səbəbinə dünyada adın yad olunub həmişə diri qalasan. Hərçənd elm əhli də başqa məxluqat kimi

zahirdə ölüb gedirlər, amma mənən onlar ölməyib, elm səbəbinə adları yad olunduğu üçün həmişə dünyada diridirlər".

Həmin mübarək kəlamın məzmununu şeyx Nizami Gəncəvi belə bəyan edir:

*Yüz il sonra sorsan: Bəs o hardadır?*
*Hər beyti səslənər: Burda, burdadır.*

Mərhum şeyx 100 il desə də, 100 ili məsəl çəkməkdən ötrü qeyd edibdir. Müəlliflər yazdıqları kitabların içində mövcuddurlar. Nə qədər ki dünya var, o kitablar da olacaq, o kitabları oxuyanlar, sanki, o kitabların müəllifləri ilə söhbət edib danışırlar. Qurani-Şərifdə elm barəsində varid olan ayələrin hər biri öz məqamında təfsir olunacaqdır. İndi isə islam qanunlarının yaradıcısı və yayanı möhtərəm uca peyğəmbərimizin elm haqqında bir neçə hədisini qeyd edək. Ta ki elmin uca dərəcəsi və alim olmanın hər bir şeydən daha fəzilətli olması barədə o cənabın möcüzəli kəlamlarından istifadə olunsun. O hədisləri uğurlu olsun deyə, o cənabın öz sözləri ilə qeyd edib ondan sonra tərcüməsini verək:

1-ci hədis: قَالَ صَلَّى اللهُ عَلَيْهِ وَآلِهِ وَسَلِّم إِنَّ الْحِكْمَةَ تَزِيدُ الشَّرِيفَ شَرَفًا، وَتَرْفَعُ الْعَبْدَ الْمَمْلُوكَ، حَتَى يدرك مدارِكَ الْمُلُوكِ *"Həqiqətən, elm və hikmət şərəfli, izzətli şəxslərin şərəfini daha artırar. Amma qulamların dərəcəsini elə ucaldar ki, ta padşahların mərtəbəsinə çatarlar"*. Bəs bu mübarək kəlamın haqlılığını bir nəfər inkar edə bilərmi? Nə çox kəndli və qulam övladı elm səbəbinə müvəffəq olub, sultanların dərəcəsinə çatıb. Tarix elminə və zəmanənin gərdişinə agah olan şəxslər bu mətləbi anlayarlar. Hz. Peyğəmbər öz qulamının oğlu Üsamə ibn Zeydi məhz elmi səbəbilə heç 25 yaşı olmadığı halda, mühacir və ənsardan ibarət olan qoşuna – hansı ki səhabələrin böyükləri də o qoşunun içində idi, əmir təyin etdi. Bu hədisin axirətə heç bir dəxli olmayıb, ancaq bizim dünyada tərəqqi tapıb uca mərtəbə sahibi olmağımızdan ötrü o cənab bu hədisi bizdən ötrü yadigar qoyub gedibdir. İslam ümməti diqqətlə nəzər etsin. Çox az yaşlı şəxslər məhz elm səbəbinə yaşlı şəxslərə hökm və rəhbərlik ediblər. Bəsrə əhli 22 yaşında olan İyas ibn Müaviyəni özlərinə qazı təyin etdi. O dövrdə Abbasilərdən xəlifə olan Mehdi ibnül-Mənsur məmləkətinin əhvalını təftiş etməkdən ötrü xilafətin paytaxtı Bağdaddan çıxıb Bəsrəyə gələndə Bəsrə əhli qabaqla-

rında İyas olaraq xəlifənin istiqbalına çıxdılar. Xəlifə Bəsrə əhlinə baxıb İyasın onlara rəhbər olduğunu görəndə bundan xoşlanmayıb, Bəsrə əhlinə xitab edib dedi: "Ey Bəsrə camaatı, bəs sizin aranızda yaşlı bir şəxs yox idi ki sizə rəhbər olaydı?" Ondan sonra üzünü İyasa tutub istehza ilə dedi: "Ey cavan, neçə yaşın var?" İyas dedi: "Allah-Təala əmirəl-mömininin ömrünü uzun etsin. Mənim yaşım Üsamə ibn Zeydin yaşı qədərdir. O vaxt ki, Hz. Peyğəmbər onu qoşuna əmir təyin etdi, o qoşunun içində Əbu Bəkir və Ömər də var idi." Xəlifə Mehdi İyasdan bu sözü eşidəndə çox xoşlanıb dedi: "Camaata rəhbər olmağa layiqsən, Allah-Təala sənin bu böyüklüyünü bərəkətli və xeyirli eləsin."

2-ci hədis: قَالَ صَلَّى اللهُ عَلَيْهِ وَآلِهِ وَسَلِّم أفضل الناس المؤمن العالم الذي إن احتيج إليه نفع وإن استغنى عنه أغنى نفسه *"Xalqın ən fəzilətlisi və ən ucası Allah-Təalaya iman gətirib alim olan şəxsdir. Əgər xalqın ona ehtiyacı olsa, o elminin səbəbinə xalqa mənfəət verər və əgər xalqın ona ehtiyacı olmasa, özünü xalqa möhtac olmaqdan qoruyar"*. Bu hədisin məzmununa fikir verilib diqqət edilsin. Əvvəlcə necə də xalqın ehtiyacı olan elmlərin öyrənilməsinə təşviq edir və sonra da xalqın ehtiyacı olmayan məqamda da elmin özü-özlüyündə gözəl bir şey olub, sahibinə gözəllik və zinət verdiyindən onun öyrənilməsini əmr edir.

3-cü hədis: قَالَ صَلَّى اللهُ عَلَيْهِ وَآلِهِ وَسَلِّم الإِيمَانُ عُرْيَانٌ، وَلِبَاسُهُ التَّقْوَى، وَزِينَتُهُ الْحَيَاءِ، وَمَالُهُ الْفِقْهُ *"Allah-Təalaya iman gətirmək bir üryan, libası olmayan şəxs kimidir"*. (Necə ki üryan şəxsə libas və başqa şeylər lazımdır, habelə imana da libas lazımdır). İmanın libası təqvadır. (Təqva - yəni xalqa zülm etməmək, xalqın malını qəsb yolu ilə almamaq və insan öldürməyi tərk etmək, şəriət və ağıla görə, hər bir çirkin olan işi tərk edib fərzləri yerinə yetirməkdir). *"İmanın zinəti həyadır. Meyvəsi elmdir"*. (Bu hədisdən məqsəd budur, necə ki üryan şəxs xalqdan qıraqda bir yerdə gizlənib, onun varlığından xalqa heç bir fayda olmaz, habelə təqvası olmayıb həya və elmdən uzaq olan iman da sahibinə heç bir fayda verməyib, o şəxs imanı olmayan şəxs kimi olacaqdır).

4-cü hədis: قَالَ صَلَّى اللهُ عَلَيْهِ وَآلِهِ وَسَلِّم لَمَوْتُ قَبِيلَةٍ أَيْسَرُ مِنْ مَوْتِ عَالِم *"Bir qəbilənin və bir camaatın ölməsi bir nəfər alimin ölməsindən yüngüldür"*. (Yəni elmsiz bir camaatla həşərat arasında fərq olmadığın-

dan onların ölməsindən insanlıq aləminə heç bir ziyan dəyməz. Amma bir alimin ölməsindən insanlığa, xüsusən, millətə böyük zərər dəydiyi üçün Hz. Peyğəmbər alimlərin ölməyinə üzülüb, bir camaatın ölməsini bir nəfər alimin ölməsindən yüngül saymışdı. Necə ki başqa bir hədisdə buyurub: "Nə zaman bir alim ölsə, onun ölməsindən islama elə bir zərər dəyər ki, heç bir şey onun yerini tuta bilməz". Amma alim necə olmalıdır, millətin ittifaqına, yoxsa cəhalətinə, parçalanmasına səbəb olmalıdır, necə insanlıq xüsusiyyətlərinə sahib olmalıdır kimi mətləblər, əlbəttə, diqqətli şəxslərə gizli deyildir.

5-ci hədis: قَالَ صَلَّى اللهُ عَلَيْهِ وَآلِهِ وَسَلَّم يوزن يوم القيامة مداد العلماء بدماء الشهداء *"Allah-Təala yolunda cihad edib dini yayanların, qanlarıyla yazaraq dini yayanların mürəkkəbləri qiyamət günündə bərabər tutular"*. Həqiqətən, ruh və bədənin yaşamasına səbəb olan qırmızı qanla qara mürəkkəbin bərabər sayılması, hətta başqa bir hədisin məzmununa görə üstün sayılması çox böyük dərəcədir. Amma bunun əksi - din və millət arasına ixtilaf və nifaq salan "alim"lərin mürəkkəbi dinin batil olması üçün səy edən düşmənlərin (müşriklərin) qanından daha xəbis və nəcisdir.

6-cı hədis: قَالَ صَلَّى اللهُ عَلَيْهِ وَآلِهِ وَسَلَّم أوحى الله عز وجل إلى إبراهيم عليه السلام يا إبراهيم إني عليم أحب كل عليم Allah-Təala Hz. İbrahimə vəhy göndərib buyurdu: *"Ey İbrahim, həqiqətən, mən aliməm və hər bir alim olan şəxsi sevərəm"*. Bu hədisdə Allah-Təala alimlər arasında fərq qoymayıbdır, hansı elm sahibini sevib, hansını sevmədiyini bəyan etməyibdir. Əlbəttə, bu məlumdur ki, elmlərin başı din elmi olub, aləmlərin yaradıcısına və onun tövhid və qüdrətinə agah olmaqdır. Ondan sonra bəşəriyyət və insaniyyət aləmində lazım olan elmləri, hətta məişət elmini öyrənmək insanı Allah-Təalaya sevdirər. Elmin şərəfinə bu kifayət edər ki, Allah-Təala buyurdu: "Hər bir alim olan şəxsi sevərəm". Şücaətli və varlı şəxsi sevərəm - demədi.

7-ci hədis: قَالَ صَلَّى اللهُ عَلَيْهِ وَآلِهِ وَسَلَّم إِذَا أَتَى عَلَيَّ يَوْمٌ لا أَزْدَادُ فِيهِ خَيْرًا يُقَرِّبُنِي إِلَى رَبِّي فَلا بُورِكَ فِي طُلُوعِ الشَّمْسِ ذَلِكَ الْيَوْمَ *Gələn o gün ki, o gündə məni Allah-Təalaya yaxınlaşdıran elmimi artırmayım (yəni o elm səbəbinə gözəl xüsusiyyətlər əldə edib, Allah-Təalanın sifətlərinə sahib olub, ya da Allah-Təalanın tövhid və qüdrətinə agah olum), qoy*

*ogünkü günün günəşinin doğmasında məndən ötrü heç bir xeyir və bərəkət olmasın.* (İnsaf gözüylə bax gör ki, Hz. Peyğəmbər kimi bir şəxs necə də hər bir zamanda özündən ötrü yeni bir elmin əldə edilməməsindən çəkinib, özündən xeyir və bərəkəti rədd edir). Allah-Təala o cənaba xitab edib belə buyurur: *"(ey Məhəmməd)*, **dua edib de ki, ey mənim rəbbim, mənim elmimi artır".** Bu mübarək kəlam o cənabdan meydana gəldi, bəs belə bir elm aşiqi peyğəmbərin ümmətinə layiqdir ki, o cənabın buyurduğu sözləri kənara qoyub, elmdən üz döndərib, fərari olsunlar? Bəs bizim bu hərəkətimiz o həzrətə böyük zülm deyilmi?

8-ci hədis: قَالَ صَلَّى اللهُ عَلَيْهِ وَآلِهِ وَسَلِّم فَضْلُ الْعَالِمِ عَلَى الْعَابِدِ كَفَضْلِ الْقَمَرِ لَيْلَةَ الْبَدْرِ عَلَى سَائِرِ الْكَوَاكِبِ (Bu hədisdə alimin abidə olan fəzilətini hər bir şəxsin idrak etməsindən ötrü sadə bir təşbehlə bəyan edir. Buyurur:) *"Alimin abid şəxsə olan fəziləti bədir gecəsində ayın ulduzlara olan fəziləti kimidir".* (Keçmiş ümmətlərdən bəzi şəxslər özlərini xədim edib dağlarda və mağaralarda, ya da abad yerlərdən kənarda vəhşi heyvanat kimi məskən salıb adlarını rahib və abid qoyub, tərki-dünya edib ibadətlə məşğul olardılar. Bu mətləb Hz. Peyğəmbərin diqqətini cəlb edib, o həzrət bu mətləbdə ictimai bir xeyir və mənfəət görməyib, mənfəəti olsa da, ancaq şəxsi olduğundan rahib və abidliyin haram olduğunu, tərk edilməsini əmr etdi. Bu çirkin əməl islam ümməti içində yayılıb, davam etməsin deyə, elmin fəzilətini, rahib və abid olmağın eybini müxtəlif hədislərdə bəyan edibdir. O cümlədən "لا رهبانية في الإسلام", yəni *"İslamda rahib olub tərki-dünya etmək caiz deyildir"* hədisi ilə Hz. Peyğəmbər rahibliyi açıq şəkildə qadağan etmişdir. Təməli elm ilə qoyulan islam bugünkü gündə cəhalət və nadanlıqdan viran olubdur. Ey peyğəmbər, Yəsrib (Mədinə) torpağından baş qaldırıb bir bu ümmətin halına bax gör ki, ümmətin arasında nifaq zahir olandan bəri elm ilə əsasını qoyduğun islam necə viran olub, müsəlmanların arasında cəhalət necə yayılıbdır? Cəhalət və nadanlıqdan az qalıbdır ki, bəni-İsrail kimi özgə millətlərin arasında qapazaltı, rüsvay və heysiyyətsiz olsunlar.

9-cu hədis: قَالَ صَلَّى اللهُ عَلَيْهِ وَآلِهِ وَسَلِّم إِنَّكُمْ أَصْبَحْتُمْ فِي زَمَانٍ كَثِيرٍ فُقَهَاؤُهُ قَلِيلٍ خُطَبَاؤُهُ، قَلِيلٍ سَائِلُوهُ، كَثِيرٍ مُعْطُوهُ، الْعَمَلُ فِيهِ خَيْرٌ مِنَ الْعِلْمِ، وَسَيَأْتِي عَلَى النَّاسِ زَمَانٌ قَلِيلٌ فُقَهَاؤُهُ، كَثِيرٌ خُطَبَاؤُهُ، قَلِيلٌ مُعْطُوهُ، كَثِيرٌ سَائِلُوهُ، الْعِلْمُ فِيهِ خَيْرٌ مِنَ الْعَمَلِ (Bu hədisdə

bizim zəmanəmizdə bizə nəyin lazım olmağını xəbər verib bizi tənbeh və xəbərdar edir. Öz zamanında olan səhabələrinə xitab edib buyurur:) *"Həqiqətən, siz elə bir zəmanədə vaqe olubsunuz ki, bu zəmanədə alimlər çoxdur, (Hz. Peyğəmbər özünün mübarək varlığına görə, o zəmanədə elm sahiblərinin çox olduğunu bəyan edir), amma Quran oxuyanlar, xətiblər və elm haqqında sual verənlər azdır, (çoxu elm əhli olduğuna görə) elm öyrədənlər çoxdur. (Elm əhli çox olduğundan) elm də çox olduğuna görə, sizin əməl edib islamın şan-şövkətini artırmanız yaxşıdır, (bildiyiniz elmə əməl edib islamın gücünü və əzəmətini çoxaldın), amma bundan sonra elə bir zaman gələr ki, o zəmanədə alimlər az olar. Quran oxuyanlar və xətiblər çox olar. Elm istəyib ehtiyacı olan çox olar. Xalqa elm öyrədən isə az olar. O zəmanədə elm əməldən yaxşıdır"*. Bu hədisin sonuna diqqət edin ki, uca Peyğəmbərimiz necə də bəsirət və doğruluqla bizim bu zəmanədə olan halımızı düşünüb və nə dərəcədə elmə ehtiyacımız olduğuna agah olub elm öyrənməyi bizə əmr edir.

Həqiqətən, hədisin sonu eynən bizim bu dövrdəki əhvalımızı xəbər verir ki, biz müsəlmanlarda elmə ehtiyacı olub öyrənmək istəyən çox olsa da, öyrədən azdır, bu səbəbdən islam ümməti bəzi elmlərdə xaricilərə möhtac olub gərək onlardan öyrənsinlər. Əgər bu hədisin şərtlərinə əməl olunsaydı, bugünkü gündə islam ümməti heç bir elmdə əcnəbilərə möhtac olmazdı. O zamanlar ki, Misir, Bağdad, Məkkə, Mədinə, Şam, Əndəlüs və başqa böyük islam ölkələrində elmin hər bir növü yayılıb çoxalırdı, yer kürəsinin başqa heç bir nöqtəsində o elmlərdən bir şey məlum deyildi. İndi nəhəng Misir ölkəsində mövcud olan mübarək Nil çayının suyunun yüksəlməsi və ya azalmasından ötrü Abbasi xəlifələri zamanında, xüsusən, əl-Mütəvəkkil Aləllah zamanında yaradılan ölçü alətləri o zəmanədə olan üləmaların riyaziyyat, həndəsə, astronomiyada bilgi sahibi olduqlarına işarə etməzmi? Qeyd olunan və digər islam ölkələrində qədim zamanlarda əsası qoyulan mədrəsə və məktəblərin varlığı, xüsusən, Səlcuqlulardan Məlik şahın vəziri tədbirli Xacə Nizamülmülkün əksər islam ölkələrində tikdirdiyi və Nizamiyyə mədrəsələri adı ilə məşhur olan o məktəblər o dövrdə elmin və sənətin çox yüksək dərəcədə inkişaf etdiyinə böyük dəlildir.

Bu zamanda o mədrəsələrin bəzisi xarab olub, bəzisi zalımlar tərəfindən karvansara (otel) kimi işlədilərək onlardan ötrü

təyin edilən vəqfləri vəzifə sahibləri və alim libasına bürünənlər özlərinə xüsusi mülk ediblər. Fatimi xəlifələrindən əl-Muiz Lidinillahın əmriylə onun qulamı Cövhər Misiri fəth edib indi də Misirdə məşhur olan Qahirənin əsasını qoyduqda indi də elm yuvası kimi mövcud olan Əzhər məscidini və ona bitişik olan mədrəsələri h. 361-ci ildə tikdirdi. Ondan sonra əl-Muiz Lidinillah 362-ci ildə Misirə gəldi. Qahirəni xilafətin paytaxtı edib Əzhər məscidinin mədrəsələrindən ötrü hər bir tərəfdən və hər bir elmə aid kitabları ora toplayıb, özgə dillərdən ərəb dilinə tərcümə etdirib, o zamanda az kitab tapılmasına baxmayaraq, 80 min cild kitablıq kitabxanalar yaratdı. Bəs o kitablar və o elmlər müsəlmanların arasından necə yox oldu, islam ümməti bu cəhalətə necə düçar oldu? Son dərəcə təəccüblüdür. Allaha həmd olsun, bu zamanda islam ümmətinin elm və sənət öyrənməyə meyil və rəğbəti olub, ümid edirik ki, bəlkə, arxdan kəsilən su bir də gələr.

Hz. Peyğəmbərin elm haqqında bəyan etdiyi hədislərin hamısını qeyd etmək mümkün olmayıb, islamda bəsirət sahiblərindən ötrü bu hədislərin biri də kifayət edər. Lakin bu 9 hədisi qeyd etməkdə məqsədimiz müqəddəs İslam şəriətinin elmə nə dərəcədə əhəmiyyət verdiyini göstərmək idi. Ta ki müsəlmanlar da o cənabın kəlamlarından elmin əhəmiyyətini anlayıb, özlərini cəhalət zindanından xilas edib, hidayət yoluna qovuşsunlar. Heç bir nadan və cahil olan qövm və camaatın dünya və axirətdə nicat tapması mümkün deyildir. Səltənət və var-dövlətdənsə, elm yaxşıdır, elm səbəbinə səltənət və var-dövlət qazanmaq olar, amma səltənət və var-dövlətlə elm qazanmaq mümkün olmaz. Elmsiz olan necə sultanlar və zəngin şəxsər elmi arzu edib, lakin öyrənmələri mümkün olmayıbdır. Abbasi xəlifələrindən əl-Mötəsim Billah elmsiz olduğundan hökmdar olmasına baxmayaraq, həmişə elm həsrətində olub, təəssüflənərdi. Elmin fəzilətini və öyrənmənin vacib olduğunu imkan olduqca uşaqların və yeniyetmələrin zehninə yerləşdirmək lazımdır.

*Elmdən başqa nədir insanı yetirən mərtəbeyi-kəmala,*
*Nə əcəb elmdən ötrü insan sərf edə taqətini cəhd ilə.*
*Hər şeyi bilən, müvəffəq və yardım edən Odur).*

تفسیر
کشف الحقائق
عن نکت الآیات
والدقائق

ثروت
و سخاوتیله مشهور
و معارف‌پرور جناب [illegible]
اهتمامیله چاپ
اولنوبدر

**Təfsiru Kəşfil-Həqayiq an Nükətil-Ayəti vəd-Dəqayiq**

Sərvət və səxavəti ilə məşhur maarifpərvər cənab Hacı Zeynalabidin Tağıyevin ianə və ihtimamilə çap olunmuşdur



## YUNİS SURƏSİ

10-cu surədir. Məkkədə nazil olub, 109 ayə, 1832 kəlmə, 9099 hərfdir.



بِسْمِ اللّٰهِ الرَّحْمٰنِ الرَّحِيمِ. الۤرٰ تِلْكَ اٰيَاتُ الْكِتَابِ الْحَكِيمِ ﴿١﴾ أَكَانَ لِلنَّاسِ عَجَبًا أَنْ أَوْحَيْنَا
إِلٰى رَجُلٍ مِنْهُمْ أَنْ أَنْذِرِ النَّاسَ وَبَشِّرِ الَّذِينَ آمَنُوا أَنَّ لَهُمْ قَدَمَ صِدْقٍ عِنْدَ رَبِّهِمْ قَالَ الْكَافِرُونَ
إِنَّ هٰذَا لَسَاحِرٌ مُبِينٌ ﴿٢﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1)** (الۤر) – (bu mübarək surə Əlif Ləm Ra surəsidir. Necə ki bundan əvvəl qeyd olunubdur, surələrin əvvəlində gələn müqəttəə hərfləri o surələrin adıdır). (تِلْكَ اٰيَاتُ الْكِتَابِ الْحَكِيمِ) - **bu surədə qeyd olunan ayələr hikmətə şamil olan surənin ayələridir.** (Ağıl sahibləri diqqətlə fikir verib onun hikmətlərini anlasınlar)**.**

**2)** (أَكَانَ لِلنَّاسِ عَجَبًا) – **bəs bu insanlardan ötrü təəccüblü işdir ki,** (أَنْ أَوْحَيْنَا إِلٰى رَجُلٍ مِنْهُمْ) - **biz onların özlərindən olan bir kişiyə vəhy göndərib onu peyğəmbər edək?** (أَنْ أَنْذِرِ النَّاسَ) - (Allah-Təalanın əzabı ilə) **insanları qorxutması üçün (ona vəhy göndərək?)** (Ta ki vəhşiliyi bir kənara qoyub insanlıq xüsusiyyətini qazansınlar), (وَبَشِّرِ الَّذِينَ آمَنُوا أَنَّ لَهُمْ قَدَمَ صِدْقٍ عِنْدَ رَبِّهِمْ) – (yenə o peyğəmbərə vəhy göndərək ki,) **müjdələsin** (Allah-Təalaya iman gətirib rəzil xüsusiyyətlərdən uzaq olan şəxsləri)**, onlardan ötrü öz rəbləri Allah-Təala yanında fəzilət və ali məqam vardır.** (Bəs onların özlərindən bir peyğəmbər göndərib ona belə hökmlər vəhy etmək təəccüblü bir şeydir ki, ona təəccüb edirlər?) (Elə ki Hz. Məhəmməd (ə.s), Məkkədə peyğəmbərliklə vəzifələndirildi, Məkkə əhli təəccüblə dedi: "Bəs Allah-Təala Əbu Talibin yetimi Məhəmməddən başqasını, bizim varlı, böyük şəxslərimizdən bir nəfər tapmadı ki, onu peyğəmbər göndərdi?" Ondan sonra Qurani-Şərifin müqabilində aciz qalıb onu sehr adlandırdılar). (قَالَ الْكَافِرُونَ إِنَّ هٰذَا لَسَاحِرٌ مُبِينٌ) - **müşriklər və bütpərəstlər dedilər: "Həqiqətən, bu Quran, əlbəttə, aşkar olan sehrbazdır.** (Bir şəxs bir məsələdə aciz qalanda belə xurafat sözlər deyər. Necə ki cahil və özünü alim sayan şəxslər bizim sözümüzə qarşı da aciz qalanda, qarşısındakı insana küfr və zındıqlıq isnad edirlər. İlahi, belə cahillərin şərindən sən özün qoru. Qurani-Şərifin inkar etməkdən onu sehr adlandırmaq Qurani-Şərifin haqq olduğuna böyük dəlildir. Ağıl sahiblərinə bu mətləb aydındır)**.**

إِنَّ رَبَّكُمُ اللَّهُ الَّذِي خَلَقَ السَّمَاوَاتِ وَالْأَرْضَ فِي سِتَّةِ أَيَّامٍ ثُمَّ اسْتَوَىٰ عَلَى الْعَرْشِ يُدَبِّرُ الْأَمْرَ مَا مِنْ شَفِيعٍ إِلَّا مِنْ بَعْدِ إِذْنِهِ ذَٰلِكُمُ اللَّهُ رَبُّكُمْ فَاعْبُدُوهُ أَفَلَا تَذَكَّرُونَ ﴿٣﴾

---

**3)** (إِنَّ رَبَّكُمُ اللَّهُ الَّذِي خَلَقَ السَّمَاوَاتِ وَالْأَرْضَ فِي سِتَّةِ أَيَّامٍ) **- həqiqətən, səmaları və yeri altı gündə yaradan, sizə tərbiyə verən rəbbiniz Allah-Təaladır.** (6 gün ifadəsi hər bir şeyin tədricən yaradıldığına işarədir), (ثُمَّ اسْتَوَىٰ عَلَى الْعَرْشِ) **- Allah-Təala səmaları və yeri yaradandan sonra ərşə hakim oldu,** (yəni taxta hakim oldu, necə ki sultan taxta sahib olanda o məmləkətə hakim olar, habelə Allah-Təalanın ərşə hakim olması da bütün şeylərə hakim olmasına işarədir). (يُدَبِّرُ الْأَمْرَ) **- bütün məxluqatın işlərini hikməti üzrə idarə edər.** (مَا مِنْ شَفِيعٍ إِلَّا مِنْ بَعْدِ إِذْنِهِ) **- heç bir məxluqun günahından ötrü qiyamət günündə şəfaət edən olmaz, ancaq Allah-Təala özü şəfaətdən ötrü izin verəndən sonra şəfaət olunar.** (Məkkə əhli - bütlər bizə şəfaət edəcək, dediklərinə görə, Allah-Təala onların iddialarını rədd edir). (ذَٰلِكُمُ اللَّهُ رَبُّكُمْ فَاعْبُدُوهُ) **- bu əzəmət və böyüklüklə vəsf olunan Allah-Təaladır, sadəcə sizin tərbiyəçiniz, rəbbiniz olan bu Allah-Təalaya ibadət edin. Ona şərik qoşmayın.** (أَفَلَا تَذَكَّرُونَ) **– bəs qəflət yuxusundan ayılıb agah* olmadınız ki, Allah-Təalanın bir şəriki yoxdur?**

*(****Qeyd:*** *Bir az təfəkkür etmək insanı öz xətasından xəbərdar edər. O səbəbdən uca Peyğəmbərimiz buyurubdur: "Bir saat təfəkkür etmək 70 illik ibadətdən** yaxşıdır". Çünki təfəkkürdən elm yaranar. Elmsiz ibadət etmək təqlidlə bir şey etmək kimidir. Quran əhli necə ki Allah-Təala Qurani-Şərifdə əmr edibdir, əgər təfəkkür etsələr, hər halda, zəlalət və cəhalət vadisində heyvanlar kimi çaşqın və sərgərdan qalmazlar. Dünya və axirətləri üçün zəruri olan şeyləri öyrənmək üçün Allah-Təalanı qoyub, insanlardan, hətta meyitdən, daş-torpaqdan yardım istəməyib, onları özlərinə şəfaətçi və məbud etməzlər. Belə qəbih işlərin səbəbi məlun cəhalətdir ki, onun ağacının kökləri bütün məxluqatın damarlarına girib, yayılıb, şəfqətli nəsihətçilərin sözü, hətta ən gözəl öyüd-nəsihət olan Qurani-Şərifin ayələri onlara təsir etmir. Qurani-Şərifdən ötrü oturub ağlamaq lazımdır ki, bugünkü gündə tərk edilib, ancaq Ramazanda və bəzi digər vaxtlardan başqa heç kim onun hikmətamiz ehkamından bir mənfəət əldə etmir. Bizim halımız da belədir, bu zamanda Qurani-Şərifi əlimizə alıb oxuyuruq, halbuki Quran bizə lənət edir. Qurani-Şərifdə zalımlara və mərdimazar şəxslərə, sələmçi və qatillərə, zalımlara kömək edənlərə və onlar kimi olanlara lənət olunubdur. Bizdə bu xüsusiyyətlər ola-ola necə Quran oxuyub Allahdan bağışlanma diləyə bilərik? Bəs Quran bizə lənət etməzmi?)*

*(*****Qeyd:*** *Hədis alimlərinə görə bu rəvayət təfəkkürün və elmin fəzilətini göstərmək üçün söylənmiş və 60 və ya 70 illik nafilə ibadətlərdən yaxşı olacağı qeyd edilmişdir. Məntiq bunu əsas göstərir. Çünki fərz ibadəti tərk edərək elmlə məşğul olmaq İslamda yoxdur. Əksinə elmlə məşğul olan fərzi təxir edib, nafiləni tərk edə bilər. (Redaktordan))*

إِلَيْهِ مَرْجِعُكُمْ جَمِيعًا ۖ وَعْدَ اللَّهِ حَقًّا ۚ إِنَّهُ يَبْدَأُ الْخَلْقَ ثُمَّ يُعِيدُهُ لِيَجْزِيَ الَّذِينَ آمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ بِالْقِسْطِ ۚ وَالَّذِينَ كَفَرُوا لَهُمْ شَرَابٌ مِنْ حَمِيمٍ وَعَذَابٌ أَلِيمٌ بِمَا كَانُوا يَكْفُرُونَ ﴿٤﴾ هُوَ الَّذِي جَعَلَ الشَّمْسَ ضِيَاءً وَالْقَمَرَ نُورًا وَقَدَّرَهُ مَنَازِلَ لِتَعْلَمُوا عَدَدَ السِّنِينَ وَالْحِسَابَ ۚ مَا خَلَقَ اللَّهُ ذَٰلِكَ إِلَّا بِالْحَقِّ ۚ يُفَصِّلُ الْآيَاتِ لِقَوْمٍ يَعْلَمُونَ ﴿٥﴾

---

**4)** (إِلَيْهِ مَرْجِعُكُمْ جَمِيعًا) **– axırda, ölümdən sonra hamınızın qayıdacağı yer Allah-Təalayadır.** (Hər şəxsin öz əməlinə müqabil ona qarşılıq verəcəkdir)**.** (وَعْدَ اللَّهِ حَقًّا) **– Allah-Təalanın** (onun tərəfinə qayıdacağınız) **vədi haqq olan vəddir,** (Allah-Təala heç vaxt vədinə xilaf olmaz)**.** (إِنَّهُ يَبْدَأُ الْخَلْقَ ثُمَّ يُعِيدُهُ) **- həqiqətən, xalqı yaradıb, ölüm onlara gələndən sonra yenidən diriləndən Allah-Təaladır.** (Hikmətə əsasən, məsul olanların əməllərinin qarşılığını onlara vermək lazım olduğuna görə, məxluqat, gərək yenidən dirilsin)**.** (لِيَجْزِيَ الَّذِينَ آمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ بِالْقِسْطِ) **– ta ki Allah-Təalaya iman gətirib, gözəl əməllər edən şəxslərə Allah-Təala ədalət üzrə xeyir və savab mükafatı versin.** (Çünki ədalətin şərti yaxşı xidmətin müqabilində onun sahibinin könlünü xoş edib, ona yaxşı mükafat verməkdir.) (وَالَّذِينَ كَفَرُوا لَهُمْ شَرَابٌ مِنْ حَمِيمٍ) **- Allah-Təalanı inkar edən şəxslərdən ötrü qiyamət günündə son dərəcə qaynar içilən şeylər vardır.** (وَعَذَابٌ أَلِيمٌ بِمَا كَانُوا يَكْفُرُونَ) **- və Allah-Təalanı inkar etdikləri üçün sonunda onlardan ötrü son dərəcə şiddətli əzab vardır.**

**5)** (هُوَ الَّذِي جَعَلَ الشَّمْسَ ضِيَاءً) **- Allah-Təala öz kamil qüdrəti ilə** (sizə bol nemət olaraq) **günəşi son dərəcə işıqlı etdi,** (belə ki, onun səbəbinə dünya işlərinizi görə biləsiniz)**,** (وَالْقَمَرَ نُورًا) **- və ayı da** (günəşin işıqlı olması kimi) **nurlu etdi.** (belə ki, onun səbəbinə gecə vaxtı bəzi işlərinizi görə biləsiniz. Ərəb dilində ziya və nurun hər ikisi işıqlıq ifadə edən kəlmələrdir. Amma ziya kəlməsi nurdan artıq işıqlıq ifadə etdiyindən günəşə, nur aya  məxsus oldu)**.** (وَقَدَّرَهُ مَنَازِلَ لِتَعْلَمُوا عَدَدَ السِّنِينَ وَالْحِسَابَ) **- Allah-Təala ayın hərəkət etməsi üçün mənzillər təyin etdi ki, onun səbəbinə illərin sayına agah olasınız.** (12 ay bir ildir) **və yerdə hər bir vaxtın, ayların və günlərin hesabına agah olasınız.** (مَا خَلَقَ اللَّهُ ذَٰلِكَ إِلَّا بِالْحَقِّ) **- Allah-Təala** (günəşi, ayı və onun mənzillərini) **əbəs və boş yerə yaratmayıbdır, ancaq haqq olaraq** (və qüdrət kəlməsini izhar etməkdən ötrü) **yaradıbdır.** (Allah-Təala həqiqi hikmət sahibidir, boş şey yaratmaz)**.** (يُفَصِّلُ الْآيَاتِ لِقَوْمٍ يَعْلَمُونَ) – (Allah-Təala tövhidinə işarə edən) **ayələri alim şəxslərdən ötrü təfsilatı ilə bəyan edir,** (belə ki, o ayələrlə tövhidi və ilahi qüdrəti anlayıb, zəlalət vadisində - şirk və inkarda qalanları saf tövhid çeşməsinə qovuşdurub, oradan su içirsinlər)**.**

*(*Qeyd: Qədim astronomlar aydan ötrü 28 mənzil qeyd edib, hər birinə bir ad veriblər. Qurani-Şərifdə bu məsələyə güclü işarə edilibdir. O mənzillərin adları bunlardır: 1-Şərətan (qoçun boynuzları) 2- Butayn (qoçun qarnı) 3- Sürəyya 4- Dəbəran*

إِنَّ فِي اخْتِلَافِ اللَّيْلِ وَالنَّهَارِ وَمَا خَلَقَ اللَّهُ فِي السَّمَاوَاتِ وَالْأَرْضِ لَاٰيَاتٍ لِقَوْمٍ يَتَّقُونَ﴿٦﴾
إِنَّ الَّذِينَ لَا يَرْجُونَ لِقَآءَنَا وَرَضُوا بِالْحَيَاةِ الدُّنْيَا وَاطْمَأَنُّوا بِهَا وَالَّذِينَ هُمْ عَنْ اٰيَاتِنَا غَافِلُونَ﴿٧﴾

---

*(əl-dəbəran) 5- Hak`a (Orionis) 6- Hən`a 7- Zira` (Aslan pəncəsi) 8- Nəsrə (aslanın burun yarığı) 9- Tərf (aslanın gözü) 10- Cəbhə (aslanın alnı) 11- Zübrə (Aslanın yeləsi) 12- Sarfə (hava dəyişikliyi) 13- Əvva (hürənlər) 14- Simak (Simak/Silahsız simak) 15- Qafr (örtü) 16- Zübana (əqrəbin qısqacı) 17- İklîl (tac) 18- Qəlb (əqrəbin qəlbi) 19- Şəvlə (əqrəbin quyruğu) 20- Nəaim (dəvəquşları) 21- Bəldə (şəhər) 22- Sə`düz-Zabih (qurban kəsənin səadəti) 23- Sə`dubula 24- Sə`düs-süud (ən yüksək səadət) 25- Sə`dül-ahbiyə (çadırlar səadəti) 26- Fə`rül-əvvəl (dolçanın ön dəliyi) 27- Fə`rüs-sani (dolçanın alt dəliyi) 28- Bətnül-hut (balığın qarnı). Bu 28 mənzilin hər birinə ay bir gecə nazil olar, elə ki 28-ci gecəsi keçdi, ondan sonra ay 2 gecə gizlənər. Əgər ay 30 gün tamam olsa, bir gecə gizlənər, əgər 29 gün olsa, ayın bu halətinə "məhaq" (son gecə) deyilər. Amma müasir astronomlar bunların hamısını bir kənara qoyublar. Ayın hərəkətində nə mənzilə, nə də başqa bir şeyə etibar edirlər. Həm qədim, həm də yeni qrupun sözləri zənn və təxminə əsaslanır. Amma necə ki daha əvvəl də qeyd elədik, Qurani-Şərif qədim astronomların sözlərini qüvvətləndirir. Doğrusunu Allah bilir. İslamda dini ehkamlar və bayramlar ayın hərəkətinə əsaslandığından müsəlmanların ay hesabını bilmələri lazım və vacibdir).*

*(Elmdən ötrü belə şəxslərin varlığı çox böyük fəzilətdir. Onlar bu zamanda iksir və ənqa kimidirlər, amma mən həqiqi alimləri nəzərdə tuturam, üləma libasını geyinib, xalqın onsuz da az olan din və imanını pozanları demirəm. Allahım, nə pis zəmanəyə düçar olmuşuq. Cahil və alim cildindəki şeytansifətlər müsəlmanları elə bir zəlalət vadisində çaşqın və sərgərdan qoymayıblar ki, onlar xilas olub qurtula bilsinlər. İlahi, hər kəsi birləşdirəcək bir kəlməni qeybdən bizə göndərib, kəlmələrin səbəb olduğu ixtilafı ittifaqa çevir. Amin!)*

**6)** (إِنَّ فِي اخْتِلَافِ اللَّيْلِ وَالنَّهَارِ) – (yenə bu ayədə Allah-Təala öz qüdrət və tövhidinə işarə edən əlamətləri bəyan edir.) **Buyurur: "Həqiqətən, gecə və gündüzün birinin gedib o birinin gəlməsində, gündüzdə günəş, gecədə ay olmasında,** (وَمَا خَلَقَ اللَّهُ فِي السَّمَاوَاتِ وَالْأَرْضِ) **və Allah-Təalanın səmalarda və yerdə yaratdığı məxluqlarda,** (لَاٰيَاتٍ لِقَوْمٍ يَتَّقُون) **- bunların hamısında, əlbəttə, müttəqi olan bir qövmdən ötrü Allah-Təalanın qüdrət və vəhdətinə bir dəlil və sübut vardır.**

**7)** (إِنَّ الَّذِينَ لَا يَرْجُونَ لِقَآءَنَا) **- həqiqətən,** (qiyamət günündə) **bizimlə qarşılaşmağı** (və bizim savab və əzabımıza düçar olmağı əsla qəlblərinə gətirməyib) **gözləməyənlər,** (وَرَضُوا بِالْحَيَاةِ الدُّنْيَا وَاطْمَأَنُّوا بِهَا) **- və** (axirət əvəzinə) **dünya həyatına razı olub,** (az olan fani şeyi çox olan əbədi şeyə üstün tutub) **və** (sanki, orada əbədi qalacaqlarmış kimi) **dünyaya meyil edənlər,** (وَالَّذِينَ هُمْ عَنْ اٰيَاتِنَا غَافِلُونَ) **- və bizim qüdrət və tövhidimizə işarə edən ayələrimizdən qafil olanlar**

أُولٰئِكَ مَأْوَاهُمُ النَّارُ بِمَا كَانُوا يَكْسِبُونَ﴿٨﴾ إِنَّ الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ يَهْدِيهِمْ رَبُّهُمْ
بِاِيمَانِهِمْۚ تَجْرِي مِنْ تَحْتِهِمُ الْأَنْهَارُ فِي جَنَّاتِ النَّعِيمِ﴿٩﴾ دَعْوٰيهُمْ فِيهَا سُبْحَانَكَ اللّٰهُمَّ وَتَحِيَّتُهُمْ
فِيهَا سَلَامٌۚ وَاٰخِرُ دَعْوٰيهُمْ اَنِ الْحَمْدُ لِلّٰهِ رَبِّ الْعَالَمِينَ۟ ﴿١٠﴾ وَلَوْ يُعَجِّلُ اللّٰهُ لِلنَّاسِ الشَّرَّ
اسْتِعْجَالَهُمْ بِالْخَيْرِ لَقُضِيَ اِلَيْهِمْ اَجَلُهُمْۜ فَنَذَرُ الَّذِينَ لَا يَرْجُونَ لِقَآءَنَا فِي طُغْيَانِهِمْ يَعْمَهُونَ ﴿١١﴾

---

**8)** (أُولٰئِكَ مَأْوَاهُمُ النَّارُ بِمَا كَانُوا يَكْسِبُونَ) **- bu şəxslərin axirətdəki məkanı və qayıdacaq yerləri dünyada qazandıqları əməlləri səbəbinə cəhənnəm odudur.**

**9)** (إِنَّ الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ) **- həqiqətən, iman gətirənlər və gözəl əməllər edənləri** (يَهْدِيهِمْ رَبُّهُمْ بِاِيمَانِهِمْ) **- Allah-Təala imanları səbəbinə nicat yolunda gedib əbədi savaba qovuşmaqda sabit və bərqərar edər.** (تَجْرِي مِنْ تَحْتِهِمُ الْأَنْهَارُ فِي جَنَّاتِ النَّعِيمِ) – (belə şəxslər Allah-Təalanın sonsuz nemətlərinin var olduğu), **qəsrlərinin altından çaylar axan Nəim cənnətlərinə daxil olarlar.**

**10)** (دَعْوٰيهُمْ فِيهَا سُبْحَانَكَ اللّٰهُمَّ) **- cənnətdə cənnət əhlinin duası budur, deyərlər ki, ilahi, hər bir eyib və nöqsandan pak və müqəddəssən.** (Yəni cənnət əhli həmişə Allah-Təalanı tənzih və təqdis etməklə məşğuldur). (وَتَحِيَّتُهُمْ فِيهَا سَلَامٌ) **- cənnət əhlinin salamlaşması bir-birilərinə rəhmət göndərməkdir.** (Necə ki müsəlmanlar dünyada qarşılaşanda, gərək, bir-birilərinə rəhmət göndərib salam versinlər, axirətdə də belədir). (وَاٰخِرُ دَعْوٰيهُمْ اَنِ الْحَمْدُ لِلّٰهِ رَبِّ الْعَالَمِينَ) **- cənnət əhlinin dualarının axırında dediyi söz budur: "Həmd aləmlərə tərbiyə verən rəbb Allah-Təalaya məxsusdur."**

**11)** (وَلَوْ يُعَجِّلُ اللّٰهُ لِلنَّاسِ الشَّرَّ) **- əgər Allah-Təala xalqa onların əməllərinə görə şər və əzab yetirməkdə tələsib, onlara tez əzab versə,** (اسْتِعْجَالَهُمْ بِالْخَيْرِ) **– necə ki onlara xeyir və fayda verəndə tələsir,** (لَقُضِيَ اِلَيْهِمْ اَجَلُهُمْ) **- hər halda, onların vaxtının bitdiyinə hökm olunub hamısı ölüb həlak olardılar, (bir nəfər də yer üzündə qalmazdı).** (فَنَذَرُ الَّذِينَ لَا يَرْجُونَ لِقَآءَنَا) **- bəlkə** (bizə asi olub qiyamət günündə) **bizimlə qarşılaşmağa ümid etməyənləri** (dünyada qoyub onlara möhlət* verib) **buraxarıq ki,** (فِي طُغْيَانِهِمْ يَعْمَهُونَ) – (itaətdən çıxıb zəlalət içində)**, tüğyan etmələrində dolansınlar.**

*(*Qeyd: Elə deyil ki, Allah-Təala dünyada asi olan şəxslərə əzab etməyə qadir olmasın. Bəlkə, onlara dünyada firavanlıq, bol nemət verərək 5 gün daha möhlət verər. Elə ki dünyadan köçdülər, o vaxt dünyada çəkdikləri ləzzətlərinin əvəzinə onlara dərd dadızdıracaqdır. Ağıllı şəxs, gərək, dünya evində islam qanunlarından kənara çıxmayıb, əlindəki dünya malı ilə din və millətinə yardım edib, xəsislik etməsin və həmişə, gərək, Allah-Təalanın rizasıyla hərəkət etsin. O şəxsə əsl kişi deyilər ki, millətin mənfəəti naminə öz şəxsi mənfəətindən keçib, hətta bu yolda can və malını itirməsinə səbir etsin. Uca Peyğəmbərimizin vəsiyyətinə əsasən, bütün müsəlmanlar,*

وَاِذَا مَسَّ الْاِنْسَانَ الضُّرُّ دَعَانَا لِجَنْبِهٖٓ اَوْ قَاعِدًا اَوْ قَٓائِمًاۚ فَلَمَّا كَشَفْنَا عَنْهُ ضُرَّهُ مَرَّ كَاَنْ لَمْ يَدْعُنَٓا اِلٰى
ضُرٍّ مَسَّهُۜ كَذٰلِكَ زُيِّنَ لِلْمُسْرِفِينَ مَا كَانُوا يَعْمَلُونَ﴿١٢﴾ وَلَقَدْ اَهْلَكْنَا الْقُرُونَ مِنْ قَبْلِكُمْ لَمَّا ظَلَمُواۙ
وَجَٓاءَتْهُمْ رُسُلُهُمْ بِالْبَيِّنَاتِ وَمَا كَانُوا لِيُؤْمِنُواۜ كَذٰلِكَ نَجْزِي الْقَوْمَ الْمُجْرِمِينَ ﴿١٣﴾ ثُمَّ جَعَلْنَاكُمْ
خَلَٓائِفَ فِي الْاَرْضِ مِنْ بَعْدِهِمْ لِنَنْظُرَ كَيْفَ تَعْمَلُونَ ﴿١٤﴾وَاِذَا تُتْلٰى عَلَيْهِمْ اٰيَاتُنَا بَيِّنَاتٍۙ

---

*gərək, belə olsunlar. Lakin belə şəxs indiki müsəlmanlar arasında yox kimidir. Bir-iki nəfər olsa da, onların mühüm bir faydası yoxdur, gərək bu işdə hamı ittifaq etsin. Hz. Peyğəmbər (ə.s), buyurubdur: "Allah-Təala camaatla birlikdədir və onlara köməkdir." Bizim vəzifəmiz deməkdir və Quranın ehtiva etdiyi mənaları ortaya çıxarmaq lazımdır).*

**12)** (وَاِذَا مَسَّ الْاِنْسَانَ الضُّرُّ) – **nə zaman insanın malına və ya bədəninə bir zərər yetişsə,** (دَعَانَا) – (hər bir halda) **dua edib bizi çağırar.** (لِجَنْبِهٖٓ) **- yanı üstündə yatanda,** (اَوْ قَاعِدًا) – **ya da oturanda,** (اَوْ قَٓائِمًا) **- və ya ayaq üstündə duranda,** (فَلَمَّا كَشَفْنَا عَنْهُ ضُرَّهُ) – (insan özünə zərər dəyib bizə dua edəndə)**, nə zaman biz onun mal və ya canına dəyən zərərini dəf edib,** (malına bərəkət və bədəninə səhhət versək), (مَرَّ كَاَنْ لَمْ يَدْعُنَٓا اِلٰى ضُرٍّ مَسَّهُ) – **sanki, ona dəyən zərərdən ötrü heç bizə dua edib, ah-nalə etməmiş kimi** (bizi yad etməyib əvvəlki yolu ilə) **keçib gedər.** (كَذٰلِكَ زُيِّنَ لِلْمُسْرِفِينَ مَا كَانُوا يَعْمَلُونَ) **-öncə qeyd olunan asilərdən ötrü xəbis nəfsləri, onların əməllərini belə süslü göstərdi,** (ta ki zərəri onlardan dəf edəndən sonra yenə Allah-Təalanı yaddan çıxarıb ona asi oldular)**.**

**13)** (وَلَقَدْ اَهْلَكْنَا الْقُرُونَ مِنْ قَبْلِكُمْ لَمَّا ظَلَمُوا) **- həqiqətən, sizdən əvvəlki dövrlərdə olan məxluqatı zülm edib** (peyğəmbərləri təkzib etdiklərində) **həlak elədik.** (Əgər zülmü özünüzə şüar etsəniz, Allah-Təala sizi də həlak etməyə qadirdir,) (وَجَٓاءَتْهُمْ رُسُلُهُمْ بِالْبَيِّنَاتِ) **- halbuki peyğəmbərlər öz doğruluqlarına açıq-aşkar olan dəlillərlə onlara gəlmişdilər.** (وَمَا كَانُوا لِيُؤْمِنُوا) – (o dəlillərə baxmayaraq) **iman etmədikləri üçün Allah-Təala onları həlak etdi,** (كَذٰلِكَ نَجْزِي الْقَوْمَ الْمُجْرِمِينَ) – (bu qeyd olunan camaatlara cəza verdiyimiz kimi onlar kimi) **asi olanlara** (peyğəmbəri təkzib edənlərə) **də belə cəza verərik.** (Necə ki Məkkə əhli Hz. Peyğəmbərə itaət etməyib onu təkzib etdilər, onunla savaşdılar, Allah-Təala da onları müsəlmanların əlində zəlil və zəbun edib, elə dağıtdı ki, bir daha birləşmələri mümkün olmadı)**.**

**14)** (ثُمَّ جَعَلْنَاكُمْ خَلَٓائِفَ فِي الْاَرْضِ مِنْ بَعْدِهِمْ) – (həlak olan) **onlardan sonra sizi yer üzündə xəlifə təyin etdik ki,** (لِنَنْظُرَ كَيْفَ تَعْمَلُونَ) **- baxıb görək siz necə** (xeyir, yoxsa şər əməl) **əməl edirsiniz,** (o vaxt da əməlinizə görə sizinlə rəftar edilər)**.**

**15)** (وَاِذَا تُتْلٰى عَلَيْهِمْ اٰيَاتُنَا بَيِّنَاتٍ) – (Hz. Məhəmməd peyğəmbər (ə.s), bizim tövhid və qüdrətimizə işarə edən) **açıq-aşkar dəlillərimizi müşriklərə oxu-**

قَالَ الَّذِينَ لَا يَرْجُونَ لِقَآءَنَا ائْتِ بِقُرْاٰنٍ غَيْرِ هٰذَآ اَوْ بَدِّلْهُۜ قُلْ مَا يَكُونُ لِيٓ اَنْ اُبَدِّلَهُ مِنْ تِلْقَآئِ نَفْسِيۚ اِنْ اَتَّبِعُ اِلَّا مَا يُوحٰىٓ اِلَيَّۚ اِنِّيٓ اَخَافُ اِنْ عَصَيْتُ رَبِّي عَذَابَ يَوْمٍ عَظِيمٍ﴿١٥﴾ قُلْ لَوْ شَآءَ اللّٰهُ مَا تَلَوْتُهُ عَلَيْكُمْ وَلَآ اَدْرٰيكُمْ بِهٖۘ

---

**duğu zaman,** (قَالَ الَّذِينَ لَا يَرْجُونَ لِقَآءَنَا ائْتِ بِقُرْاٰنٍ غَيْرِ هٰذَآ اَوْ بَدِّلْهُ) **- o vaxt qiyamət günündə bizimlə qarşılaşmağa ümid və etiqadları olmayan şəxslər dedilər: “Bizdən ötrü bu Qurandan başqa, bir Quran* gətir** (ki, onda bizim bütlərimizin məzamməti olmasın)**. Ya da həmin Quranın ayələrini dəyişdir,** (əzab ayəsinin yerinə rəhmət ayələrini qoyub məbudlarımızın adlarını oradan çıxart)**.** (قُلْ مَا يَكُونُ لِيٓ اَنْ اُبَدِّلَهُ مِنْ تِلْقَآئِ نَفْسِي) – (ey Məhəmməd)**, müşriklərə de: “Məndən ötrü caiz deyil ki, öz yanımdan** (ilahi bir əmr olmadan) **Quranın ayələrini dəyişdirib əzab ayəsinin yerinə rəhmət ayəsini zikr edim.** (Ayələrin yerini dəyişdirmək insanın gücü daxilində olduğundan belə cavab verildi. Amma Quran möcüzə olub başqa bir Quran gətirmək insanın qüdrətindən kənar olduğu üçün başqa cür cavab verilmədi)**.** (اِنْ اَتَّبِعُ اِلَّا مَا يُوحٰىٓ اِلَيَّ) **- mən** (Qurani-Şərifdə) **Allah-Təaladan mənə vəhy olunan şeydən başqasına tabe deyiləm.** (Quran ayələrini dəyişdirməyə heç qadir deyiləm)**.** (اِنِّيٓ اَخَافُ اِنْ عَصَيْتُ رَبِّي عَذَابَ يَوْمٍ عَظِيمٍ) **- həqiqətən, əgər mənə tərbiyə verən rəbb Allah-Təalaya asi olsam, böyük bir günün** (qiyamət günü) **əzabından qorxaram.**

*(*Qeyd: “الغريق يتشبث بكل حشيش/Suda boğulan san çöpünə belə ümid edər.” zərbməsəldir, suya qərq olan əlinə nə keçsə, möhkəm yapışar növündən bir sözdür. Müşriklər Qurani-Şərifin müqabilində aciz qalıb onu inkar etmək üçün heç bir dəlil tapa bilməyib belə bir xurafat və mənasız sözlərə yapışırlar, halbuki fəsahətli və bəlağətli şəxslər idilər, xətib, şair və gözəl kəlamlar tərtib etməkdə ustad idilər. Qurani-Şərifin müqabilində belə şəxslərin aciz qalması, ondan sonra da belə mənasız sözlər demələri Qurani-Şərifin haqq olduğuna dəlil deyilmi? Ağıl sahibləri diqqət etsinlər).*

**16)** (قُلْ لَوْ شَآءَ اللّٰهُ مَا تَلَوْتُهُ عَلَيْكُمْ وَلَآ اَدْرٰيكُمْ بِهٖ) – (ey Məhəmməd)**, müşriklərə de ki, əgər Allah-Təala bu Quranı sizə oxumamağımı və onun mətləblərini sizə bildirməməmi istəsəydi, hər halda oxumazdım və bildirməzdim.** (Amma Allah-Təala bu Quranı sizə oxumamı və onun mətləblərini sizə bildirməmi istəyir. Allah-Təala mənim kimi təhsilsiz, ömrü boyu bir alimin də yanında oturub, ondan bir şey öyrənməyən şəxsi sizə göndərib, hansı ki böyüdüyü şəhərdə bir nəfər yəhudi və xristian alimi də olmayıb. Belə bir şəxs gəlib sizə bu Quranı oxuyur, hansı ki bütün fəsih nəzm və nəsr kəlamların hamısından üstün olub, hər bir elmlə də, ehkam, tarix və hikmətamiz sözlərlə dolu olub, Allah-Təaladan başqa, heç kimin bilmədiyi qeyb elmini də sizə xəbər verir. Və o şəxs özü də sizin aranızda 40 il ömür sürüb, bu 40 il içində ondan heç vaxt belə sözlər eşitməmisiniz və onu yaxşı tanıyırsınız, bəs belə

فَقَدْ لَبِثْتُ فِيكُمْ عُمُرًا مِنْ قَبْلِهِ اَفَلَا تَعْقِلُونَ ﴿١٦﴾ فَمَنْ اَظْلَمُ مِمَّنِ افْتَرٰى عَلَى اللّٰهِ كَذِبًا اَوْ كَذَّبَ
بِاٰيَاتِهِ اِنَّهُ لَا يُفْلِحُ الْمُجْرِمُونَ ﴿١٧﴾ وَيَعْبُدُونَ مِنْ دُونِ اللّٰهِ مَا لَا يَضُرُّهُمْ وَلَا يَنْفَعُهُمْ وَيَقُولُونَ
هٰؤُلَٓاءِ شُفَعَٓاؤُنَا عِنْدَ اللّٰهِ

---

bir şəxsi təkzib edib onun gətirdiyi Quranı xurafat saymaq olarmı? Belə sözlər ancaq cəhalətdən deyilər. Öncə insafla təfəkkür edib, ondan sonra Quranın haqq və ya batil olması haqqında danışmaq lazımdır)**.** (فَقَدْ لَبِثْتُ فِيكُمْ عُمُرًا مِنْ قَبْلِهِ) **- həqiqətən, mən siz müşriklərin** (Məkkə əhli) **arasında** (bu Quran mənə nazil olmadan) **qabaq çox ömür** (40 il) **sürüb dolanmışam.** (Bəs məndən belə rəftar və söz görüb eşitmişdinizmi?) (اَفَلَا تَعْقِلُونَ) **– bəs ağılla rəftar etməzsəniz,** (ta ki dürüst fikir verib biləsiniz ki, bu Quran Allah-Təaladandır. Mənim onu özümdən* icad etməyim mümkün deyildir)**.**

*(*Qeyd:* **Bəli, əgər Peyğəmbərin Quranı özündən icad etmək imkanı olsaydı, hər halda, ondan başqa fəsih və bəlağətli şəxslərdən ötrü də bu, mümkün olardı, çünki Hz. Peyğəmbər də məkkəli bir şəxs idi, Məkkədə fəsih şəxslər var idi. Necə ola bilər ki, o fəsih şəxslərdən heç biri Quranın, ən azından bir surənin mislini gətirməyə qadir olmasın? Bu, Qurani-Şərifin Allah-Təala tərəfindən olmasındandır. Və heç kimdə Quranın müqabilində bir söz deməyə qüdrət olmadı, halbuki Hz. Peyğəmbərə həsəd edən bir çox düşməni var idi. Bu, Allahın lütfüdür və istədiyinə bəxş edər).*

**17)** (فَمَنْ اَظْلَمُ مِمَّنِ افْتَرٰى عَلَى اللّٰهِ كَذِبًا اَوْ كَذَّبَ بِاٰيَاتِهِ) **- Allah-Təalaya yalan sözlərlə iftira edən, ya da Allah-Təalanın ayələrini təkzib edən şəxsdən daha zalım olan kimdir?** (Əgər Məhəmməd Allah-Təalaya iftira edirsə, demək o zalımdır. Əgər o, haqlıdırsa, demək siz müşriklər Allah-Təalanın ayələrini təkzib edirsiniz, zalım olan sizsiniz. Ağıllı və insaflı şəxslər bu sözlərdən Hz. Peyğəmbərin və Quranın haqq olduğunu dərk edə bilərlər, çünki heç kim zalım da olsa, öz zalımlığını qəbul etməz. Bu kəlam kinayə ilə özünün doğruluğunu və müxalifinin yalançı və zalım olduğunu isbat edir. Bu mətləbin dərk edilməsi ağıllı şəxslərə həvalə olunur). (اِنَّهُ لَا يُفْلِحُ الْمُجْرِمُونَ) **- həqiqətən,** (Quranı təkzib edən) **asi və zalım şəxslər nicat tapmazlar.** (Dünya və axirətdə əzaba düçar olarlar. Müşriklərin dünyada əzaba düçar olması axirətdə də əzab ediləcəklərinə işarədir)**.**

**18)** (وَيَعْبُدُونَ مِنْ دُونِ اللّٰهِ مَا لَا يَضُرُّهُمْ وَلَا يَنْفَعُهُمْ) – (görün bu müşriklər nə qədər elmsiz camaatdırlar)**, Allah-Təaladan başqa cansız şeylərə ibadət edirlər, hansı ki onlara nə zərər, nə də mənfəət verə bilməzlər.** (وَيَقُولُونَ هٰؤُلَٓاءِ شُفَعَٓاؤُنَا عِنْدَ اللّٰهِ) **- bütlərə ibadət edib deyirlər: "Onlar Allah-Təala yanında şəfaət edəndirlər."** (Qüreyşdən Nəzr ibnül-Haris deyirdi: "əl-Lat və əl-Uzza qiyamət günündə məndən ötrü şəfaət edəcəklər." Allah-Təaladan başqa canlı, cansız bir şeydən yardım istəmək, şəfaətinə ümid etmək insanı müşriklərin cərgəsinə

قُلْ اَتُنَبِّؤُنَ اللّٰهَ بِمَا لَا يَعْلَمُ فِي السَّمٰوَاتِ وَلَا فِي الْاَرْضِ سُبْحَانَهُ وَتَعَالٰى عَمَّا يُشْرِكُونَ ﴿١٨﴾ وَمَا كَانَ النَّاسُ اِلَّا اُمَّةً وَاحِدَةً فَاخْتَلَفُواۜ

daxil edər). (قُلْ اَتُنَبِّؤُنَ اللّٰهَ بِمَا لَا يَعْلَمُ فِي السَّمٰوَاتِ وَلَا فِي الْاَرْضِ) – (ey Məhəmməd, müşriklərə) **de: bəs Allah-Təalaya o şeyi** (Allah-Təalaya şərik olmağı) **xəbər verirsiniz ki, nə səmalarda və nə yerlərdə onu bilmir?** (Allah-Təalanın bir şeyi bilməməsi o şeyin olmadığına işarədir) (سُبْحَانَهُ وَتَعَالٰى عَمَّا يُشْرِكُونَ) **- Allah-Təala ona şərik qoşduğunuz şeylərdən pak, müqəddəs və ucadır.** (O şeylərin hamısı Allah-Təalanın məxluqudur. Necə ola bilər ki, məxluq Allah-Təalaya şərik olsun. Əgər diqqət edilsə, görülər ki, indi də insanlar öz məzhəb başçılarını Allah-Təalaya şərik sayırlar, bu sözün doğruluğu aqil və arif şəxslərə zahir və aşkardır)**.**

**19)** (وَمَا كَانَ النَّاسُ اِلَّا اُمَّةً وَاحِدَةً) **-** (Adəm peyğəmbərin zamanından ta İdris peyğəmbərin zamanına qədər) **bütün insanlar vahid bir ümmət** (tövhidə inanan) **idi,** (فَاخْتَلَفُوا) *** sonra** (aralarında ixtilaf düşdüyü üçün) **ayrıldılar.**

*(****Qeyd:*** *İdris peyğəmbərin bir şagirdi var idi, İdris peyğəmbəri çox sevərdi. Elə ki Hz. İdris vəfat etdi, təsəlli tapmaq üçün onun surətini çəkib, ona baxıb rahat olurdu. O şəxs vəfat edəndən sonra onun ibadət yerindən o surəti tapdılar. Dedilər: "Yəqin bu şəxs bu surətə sitayiş edirmiş." Ondan sonra bütpərəstlik dini yarandı. Şirk və bütpərəstlik şəkil çəkmədən yarandığından islamın göz nuru möhtərəm peyğəmbərimiz şəkil çəkməyi haram və şəklin evdə saxlanmasını qadağan etdi. Amma müsəlmanların bəzisi o cənabın sözünə xilaf çıxıb, nəinki evdə şəkil saxlayırlar, hətta öz xəyali təsəvvürləri ilə başı insan, quyruğu tovuz, ayaqları qatıra bənzəyən heyvanın üstündə, üzündə də müxtəlif rənglərlə örtü onun öz surətini çəkib, məscidlərdə asıb, bunu Allah-Təalaya yaxınlıq vasitəsi sayırlar. Bəs belə şəxslərə müsəlman demək olarmı? Ruh sahibinin surəti haram olmaqla birlikdə, onun heykəlini saxlamaq ikiqat haramdır. Müsəlmanların indiki dövrdə ehtiramla evlərində saxladığı heykəllərin oxşarını kainatın fəxri olan Hz. Peyğəmbər Məkkədə öz əli ilə yerə yıxıb məhv etdi. Məkkənin fəthindən əvvəl Hz. Peyğəmbər Məkkədə olan zaman Əli ibn Əbu Talib onun yanında dayanıb gözləyərdi ki, görsün Məscidül-həram nə vaxt boşalacaq ki, gedib Haqqa ibadət etsinlər. Elə ki Məscidül-həram boşalırdı, gizlincə Əlini götürüb Kəbə divarının yanında oturdub özü Əlinin çiyninə çıxdı ki, Kəbənin damının üstünə çıxıb orada olan bütləri yerə yıxsın. Hz. Əli deyir: "Hz. Peyğəmbər gördü ki, mənim onu tutmağa gücüm çatmır, aşağı enib özü əyləşdi, mənə dedi ki, ayağını mənim çiynimə qoyub damın üstünə çıx. O həzrətin əmrinə görə, ayağımı onun çiyninə qoyub damın üstünə çıxdım. Orada olan bütləri tamamən yıxıb aşağı düşdüm. Hz. Peyğəmbərlə gizlincə qaçıb Məkkənin küçələrinə daxil olduq ki, bizi görən olmasın. Müsəlmanlar o cənabın əməllərinə fikir verib, gərək ona tabe olsunlar, bu kitabı oxuyan şəxslərdən ümidimiz odur ki, şəkil saxlamağı özləri tərk etməklə yanaşı, başqa şəxslərin də bu qəbih əməli, xüsusən, heykəl saxlamağı tərk etmələrini təşviq etsinlər).*

وَلَوْلَا كَلِمَةٌ سَبَقَتْ مِنْ رَبِّكَ لَقُضِيَ بَيْنَهُمْ فِيمَا فِيهِ يَخْتَلِفُونَ ﴿١٩﴾ وَيَقُولُونَ لَوْلَٓا اُنْزِلَ عَلَيْهِ اٰيَةٌ
مِنْ رَبِّهِۚ فَقُلْ اِنَّمَا الْغَيْبُ لِلّٰهِ فَانْتَظِرُواۚ اِنِّي مَعَكُمْ مِنَ الْمُنْتَظِرِينَ ﴿٢٠﴾ وَاِذَٓا اَذَقْنَا النَّاسَ رَحْمَةً مِنْ
بَعْدِ ضَرَّٓاءَ مَسَّتْهُمْ اِذَا لَهُمْ مَكْرٌ فِيٓ اٰيَاتِنَاۜ قُلِ اللّٰهُ اَسْرَعُ مَكْرًاۜ اِنَّ رُسُلَنَا يَكْتُبُونَ مَا تَمْكُرُونَ ﴿٢١﴾
هُوَ الَّذِي يُسَيِّرُكُمْ فِي الْبَرِّ وَالْبَحْرِۜ حَتّٰٓى اِذَا كُنْتُمْ فِي الْفُلْكِۚ وَجَرَيْنَ بِهِمْ بِرِيحٍ طَيِّبَةٍ

---

**İdris peyğəmbərin zamanından sonra insanlıq dinlərində ixtilaf edib** (bütpərəstlik və müşriklik meydana gəldi)**.** (وَلَوْلَا كَلِمَةٌ سَبَقَتْ مِنْ رَبِّكَ) - (ey Məhəmməd)**, əgər bundan qabaq əzəldə sənin rəbbin Allah-Təalanın elmində bu söz keçməsəydi** (ki, dünya təklif və seçim yeri, axirət savab və cəza yeridir), (لَقُضِيَ بَيْنَهُمْ فِيمَا فِيهِ يَخْتَلِفُونَ) **- hər halda, haqda ixtilaf etdiklərinə görə, insanların arasında hökm olunub** (dünyada cəzaları verilərdi, lakin dünya təklif yeri olduğuna görə onların cəzası axirətə təxirə salındı)**.**

**20)** (وَيَقُولُونَ لَوْلَٓا اُنْزِلَ عَلَيْهِ اٰيَةٌ مِنْ رَبِّهِ) **- müşriklər deyirlər: "Nədən ötrü bu peyğəmbərə** (Məhəmmədə) **rəbbi Allah-Təaladan bir möcüzə nazil olmur?"** (فَقُلْ اِنَّمَا الْغَيْبُ لِلّٰهِ) **- ey Məhəmməd, de ki, qeyb elmi Allah-Təalaya məxsusdur.** (Allah-Təalanın istədiyiniz möcüzələri verməməsinin səbəbi budur. Onun elmi Allah-Təalanın yanındadır)**.** (فَانْتَظِرُوا) **– gözləyin** (Allah-Təaladan istədiyiniz şeyləri - möcüzələri), (اِنِّي مَعَكُمْ مِنَ الْمُنْتَظِرِينَ) **- həqiqətən, mən də sizinlə birlikdə gözləyənlərdənəm,** (görək Allah-Təala bu inadınızın müqabilində nə bəla göndərəcək? Allah-Təala Məkkə əhlini 7 il qəhətliyə düçar elədi. Ondan sonra onlara rəhm edib qəhətliyi onlardan götürdü. Yenə ibrət almayıb, Qurana tənə edib, Hz. Peyğəmbərlə düşmənçiliyə davam etdilər)**.**

**21)** (وَاِذَٓا اَذَقْنَا النَّاسَ رَحْمَةً مِنْ بَعْدِ ضَرَّٓاءَ مَسَّتْهُمْ) **– onlara yetişən bəla və müsibətdən sonra insanlara** (Məkkə əhlinə) **öz rəhmətimizi dadızdırdığımız zaman,** (yəni 7 il qəhətlikdən sonra onlara yağış göndərdikdə), (اِذَا لَهُمْ مَكْرٌ فِيٓ اٰيَاتِنَا) **-** (ey Məhəmməd)**, baxıb görərsən ki, qəlblərində bizim ayələrimiz haqqında gizli məkr və hiylə vardır,** (قُلِ اللّٰهُ اَسْرَعُ مَكْرًا) **–** (ey Məhəmməd, onlara) **de ki, Allah-Təala** (sizin məkr və hiylənizin müqabilində) **sürətlə sizdən intiqam alar,** (sizin islamın nurunu söndürmək istəməyinizdən qabaq Allah-Təala sizə əzab edəcəkdir. Necə ki Bədir savaşında etdi)**.** (اِنَّ رُسُلَنَا يَكْتُبُونَ مَا تَمْكُرُونَ) **- bizim tərəfimizdən göndərilən mələklər sizin məkr və hiylənizi yazıb saxlayarlar.**

**22)** (هُوَ الَّذِي يُسَيِّرُكُمْ فِي الْبَرِّ وَالْبَحْرِ) **–** (Allah-Təala) **öz kamil qüdrəti ilə sizi çöldə və dənizdə hərəkət etdirər,** (sizdən ötrü hər bir səbəbi yaradıb ki, çöldə və dənizdə hərəkət edib məişətinizi təmin edəsiniz)**.** (حَتّٰٓى اِذَا كُنْتُمْ فِي الْفُلْكِ) **– hətta** (hərəkət zamanı siz dənizdə) **gəmi içində olanda,** (وَجَرَيْنَ بِهِمْ بِرِيحٍ طَيِّبَةٍ) **– və gəmilər minənlərlə birlikdə dənizdə məqsədəuyğun hərəkət**

وَفَرِحُوا بِهَا جَٓاءَتْهَا رِيحٌ عَاصِفٌ وَجَٓاءَهُمُ الْمَوْجُ مِنْ كُلِّ مَكَانٍ وَظَنُّوٓا اَنَّهُمْ اُحِيطَ بِهِمْ ۙ دَعَوُا اللّٰهَ مُخْلِصِينَ لَهُ الدِّينَ ۚ لَئِنْ اَنْجَيْتَنَا مِنْ هٰذِهِ لَنَكُونَنَّ مِنَ الشَّاكِرِينَ ﴿٢٢﴾ فَلَمَّٓا اَنْجٰيهُمْ اِذَا هُمْ يَبْغُونَ فِي الْاَرْضِ بِغَيْرِ الْحَقِّ ۜ يَٓا اَيُّهَا النَّاسُ اِنَّمَا بَغْيُكُمْ عَلٰٓى اَنْفُسِكُمْ ۙ مَتَاعَ الْحَيٰوةِ الدُّنْيَا ثُمَّ اِلَيْنَا مَرْجِعُكُمْ فَنُنَبِّئُكُمْ بِمَا كُنْتُمْ تَعْمَلُونَ ﴿٢٣﴾ اِنَّمَا مَثَلُ الْحَيٰوةِ الدُّنْيَا كَمَٓاءٍ اَنْزَلْنَاهُ مِنَ السَّمَٓاءِ فَاخْتَلَطَ بِهِ نَبَاتُ الْاَرْضِ مِمَّا يَاْكُلُ النَّاسُ وَالْاَنْعَامُ ۜ حَتّٰٓى اِذَٓا اَخَذَتِ الْاَرْضُ زُخْرُفَهَا وَازَّيَّنَتْ وَظَنَّ اَهْلُهَٓا اَنَّهُمْ قَادِرُونَ عَلَيْهَٓا ۙ اَتٰيهَٓا اَمْرُنَا لَيْلًا اَوْ نَهَارًا

---

**edib, gəmidə olanlar da gözəl küləyin hərəkət etməsi səbəbilə şad olanda,** (وَفَرِحُوا بِهَا جَٓاءَتْهَا رِيحٌ عَاصِفٌ) – (o gözəl küləyin əvəzinə) **möhkəm şiddətli bir külək əsib,** (onların məqsədlərinə çatmasına mane olar), (وَجَٓاءَهُمُ الْمَوْجُ مِنْ كُلِّ مَكَانٍ) – (o şiddətli küləyin hərəkətindən) **dənizin dalğaları hər bir tərəfdən onlara gələr,** (وَظَنُّوٓا اَنَّهُمْ اُحِيطَ بِهِمْ) **- zənn edərlər ki, həqiqətən, dalğalar onları bürüyüb, hamısı həlak olacaqlar.** (دَعَوُا اللّٰهَ مُخْلِصِينَ لَهُ الدِّينَ) **- din və imanlarını Allah-Təaladan ötrü ixlaslı edərək** (və ya) **edən halətdə halda Allah-Təalanı çağırıb dua edərlər:** (لَئِنْ اَنْجَيْتَنَا مِنْ هٰذِهِ) – (Allah-Təalaya belə dua edərlər: ey bizim rəbbimiz), **əgər bizə bu bəladan nicat versən,** (لَنَكُونَنَّ مِنَ الشَّاكِرِينَ) **- əlbəttə, sənə şükür edən bəndələrindən olarıq.** (Çünki bizə belə böyük bir bəladan nicat verib, həyat nemətini bizdən əsirgəmədin).

**23)** (فَلَمَّٓا اَنْجٰيهُمْ) **– Allah-Təala** (dualarını qəbul edib) **onlara nicat verdikdə isə,** (اِذَا هُمْ يَبْغُونَ فِي الْاَرْضِ بِغَيْرِ الْحَقِّ) - (ey Məhəmməd), **qəfildən görərsən ki, onları zülm və haqsızlıqla yer üzündə fəsad çıxarıb** (Allah-Təalanın nazil etdiyi hökmlərin xilafını edərlər). (يَٓا اَيُّهَا النَّاسُ اِنَّمَا بَغْيُكُمْ عَلٰٓى اَنْفُسِكُمْ مَتَاعَ الْحَيٰوةِ الدُّنْيَا) **- ey insanlar, həqiqətən, sizin fəsad çıxarmağınız, özünüz kimi olan şəxslərə zülm etməyiniz dünya həyatının müvəqqəti mənfəətidir.** (Siz onu mənfəət hesab edirsiniz, amma onun cəzası sizə axirət günündə yetişəcəkdir). (ثُمَّ اِلَيْنَا مَرْجِعُكُمْ) – (dünyada zülm edəndən və öləndən) **sonra sizin qayıdacağınız yer bizim tərəfimizə olacaqdır.** (فَنُنَبِّئُكُمْ بِمَا كُنْتُمْ تَعْمَلُونَ) **– o zaman da dünyada etdiyiniz o zülm və fəsadları sizə xəbər verib onların cəzasını sizə yetirərik.**

**24)** (اِنَّمَا مَثَلُ الْحَيٰوةِ الدُّنْيَا) **- həqiqətən, dünya həyatının məsəli** (كَمَٓاءٍ اَنْزَلْنَاهُ مِنَ السَّمَٓاءِ) **- səmadan göndərdiyimiz su misalı kimidir ki,** (فَاخْتَلَطَ بِهِ نَبَاتُ الْاَرْضِ) **- yerin ot-ələfi o suya qarışar** (və o suyun səbəbinə onların hamısı bitər). (مِمَّا يَاْكُلُ النَّاسُ وَالْاَنْعَامُ) **- o ot-ələflər həm insanın, həm də heyvanatın yediyindən olar.** (حَتّٰٓى اِذَٓا اَخَذَتِ الْاَرْضُ زُخْرُفَهَا وَازَّيَّنَتْ) **- ta ki** (otların yetişib göyərməsi və növbənöv güllərin, çiçəklərin açması səbəbinə) **yer hüsn və gözəlliyini, təravətini əldə edər, zinətlənib gözəlləşər.** (وَظَنَّ اَهْلُهَٓا اَنَّهُمْ قَادِرُونَ عَلَيْهَٓا) **- o yerin əhli güman edər ki, onlara** (yerdə olan növbənöv meyvələri, bitkiləri yığıb toplamağa və mənfəət almağa) **qadir olacaqlar.** (اَتٰيهَٓا اَمْرُنَا لَيْلًا اَوْ نَهَارًا) – (və belə

فَجَعَلْنَاهَا حَصِيدًا كَاَنْ لَمْ تَغْنَ بِالْاَمْسِۜ كَذٰلِكَ نُفَصِّلُ الْاٰيَاتِ لِقَوْمٍ يَتَفَكَّرُونَ ﴿٢٤﴾ وَاللّٰهُ يَدْعُوٓا
اِلٰى دَارِ السَّلَامِۜ وَيَهْدِي مَنْ يَشَٓاءُ اِلٰى صِرَاطٍ مُسْتَقِيمٍ ﴿٢٥﴾ لِلَّذِينَ اَحْسَنُوا الْحُسْنٰى وَزِيَادَةٌۜ
وَلَا يَرْهَقُ وُجُوهَهُمْ قَتَرٌ وَلَا ذِلَّةٌۜ اُولٰٓئِكَ اَصْحَابُ الْجَنَّةِۚ هُمْ فِيهَا خَالِدُونَ ﴿٢٦﴾ وَالَّذِينَ كَسَبُوا
السَّيِّاٰتِ جَزَٓاءُ سَيِّئَةٍ بِمِثْلِهَاۙ وَتَرْهَقُهُمْ ذِلَّةٌۜ مَا لَهُمْ مِنَ اللّٰهِ مِنْ عَاصِمٍۚ كَاَنَّمَٓا اُغْشِيَتْ وُجُوهُهُمْ قِطَعًا
مِنَ الَّيْلِ مُظْلِمًاۜ

---

bir halətdə asi olduqlarına görə) **gecə, ya da gündüz onlara əmrimiz gələr.** (Səmadan bir bəla göndərib o şeylərin hamısını yox edərik). (فَجَعَلْنَاهَا حَصِيدًا كَاَنْ لَمْ تَغْنَ بِالْاَمْسِ) - **yerdə olan şeylərin hamısını sanki dünən heç göyərməmiş kimi kəsilib biçilmiş edərik.** (كَذٰلِكَ نُفَصِّلُ الْاٰيَاتِ لِقَوْمٍ يَتَفَكَّرُونَ) – (dünya* həyatının barəsində ağıl sahibi olub, Allah-Təalanın ayələrini) **düşünən bir camaatdan ötrü öz ayələrimizi təfsilatı ilə belə bəyan edərik.**

*(***Qeyd:** Allah-Təala bu ayədə dünyanın halını və sürətlə məhv olan nemətlərini ot-ələfə oxşadır. Hansı ki yaşıllaşıb, təravətlənəndən sonra tezliklə quruyub, yox olurlar. Belə şeylərə aldanmaq ağıllı şəxslərə yaraşmayan əməldir. Amma dünyada insanlar fani, insanlıq isə əbədi olduğu üçün, qüdrətli və varlı şəxslər, hətta bütün insanlar, hər kəs öz gücünə görə, öz din və məzhəb əhlinə yardım etməli, onları zillətdən izzətə, cəhalətdən elmə yönəltməlidir, ağıl və insaf da bunu tələb edir. Heyf ki, əsl insanlıq itib, şeytanlıq və cəhalət yayılıbdır).*

**25)** (وَاللّٰهُ يَدْعُوٓا اِلٰى دَارِ السَّلَامِ) - **Allah-Təala insanları əmin-amanlıq yurduna** (cənnətə) **çağırır,** (وَيَهْدِي مَنْ يَشَٓاءُ اِلٰى صِرَاطٍ مُسْتَقِيمٍ) - **və Allah-Təala istədiyini** (yaxşı əməl sahiblərini) **düz yola hidayət edib yardım edər.**

**26)** (لِلَّذِينَ اَحْسَنُوا الْحُسْنٰى وَزِيَادَةٌ) - **yaxşı və gözəl əməl sahiblərindən ötrü yaxşı, gözəl əcr və savab,** (Allahın lütfü olaraq) **daha artığı da var.** (وَلَا يَرْهَقُ وُجُوهَهُمْ قَتَرٌ وَلَا ذِلَّةٌ) – (qiyamət günündə) **yaxşı əməl sahiblərinin üzünə nə qara bir toz, nə də zillət qonmaz,** (necə ki qiyamət günündə pis əməl sahiblərinin üzlərindən əzab əhli olduqları məlum olar). (اُولٰٓئِكَ اَصْحَابُ الْجَنَّةِ هُمْ فِيهَا خَالِدُونَ) - **cənnətin sahibləri onlardır və orada həmişəlik qalarlar.**

**27)** (وَالَّذِينَ كَسَبُوا السَّيِّاٰتِ جَزَٓاءُ سَيِّئَةٍ بِمِثْلِهَا) - (Allah-Təalaya asi olub)**, günahlar qazananlara günahlarının misli qədər cəza verilər.** (Allah-Təala günahkarlarla ədalət üzrə rəftar edib bir günaha bir cəza verər. Amma savab sahiblərinə lütf və rəhmətlə rəftar edib, bir savaba saysız-hesabsız əcr və mükafatlar verər). (وَتَرْهَقُهُمْ ذِلَّةٌ) – **(qiyamət günündə) günahkarları zillət basar.** (مَا لَهُمْ مِنَ اللّٰهِ مِنْ عَاصِمٍ) –**Allah-Təalanın əzabından onları qoruyub saxlayan da olmaz.** (كَاَنَّمَٓا اُغْشِيَتْ وُجُوهُهُمْ قِطَعًا مِنَ الَّيْلِ مُظْلِمًا) – **sanki gecənin zülmət parçası onların üzlərini bürüyüb örtübdür.** (Cəhənnəm əhlinin sifəti budur, üzləri qaranlıq

اُولٰٓئِكَ اَصْحَابُ النَّارِۚ هُمْ فِيهَا خَالِدُونَ ﴿٢٧﴾وَيَوْمَ نَحْشُرُهُمْ جَمِيعًا ثُمَّ نَقُولُ لِلَّذِينَ اَشْرَكُوا
مَكَانَكُمْ اَنْتُمْ وَشُرَكَآؤُكُمْۚ فَزَيَّلْنَا بَيْنَهُمْ وَقَالَ شُرَكَآؤُهُمْ مَا كُنْتُمْ اِيَّانَا تَعْبُدُونَ ﴿٢٨﴾ فَكَفٰى بِاللّٰهِ
شَهِيدًا بَيْنَنَا وَبَيْنَكُمْ اِنْ كُنَّا عَنْ عِبَادَتِكُمْ لَغَافِلِينَ ﴿٢٩﴾ هُنَالِكَ تَبْلُوا كُلُّ نَفْسٍ مَٓا اَسْلَفَتْ وَرُدُّٓوا
اِلَى اللّٰهِ مَوْلٰيهُمُ الْحَقِّ وَضَلَّ عَنْهُمْ مَا كَانُوا يَفْتَرُونَ۟ ﴿٣٠﴾ قُلْ مَنْ يَرْزُقُكُمْ مِنَ السَّمَٓاءِ وَالْاَرْضِ
اَمَّنْ يَمْلِكُ السَّمْعَ وَالْاَبْصَارَ وَمَنْ يُخْرِجُ الْحَيَّ مِنَ الْمَيِّتِ وَيُخْرِجُ الْمَيِّتَ مِنَ الْحَيِّ وَمَنْ يُدَبِّرُ
الْاَمْرَۜ فَسَيَقُولُونَ اللّٰهُۚ فَقُلْ اَفَلَا تَتَّقُونَ ﴿٣١﴾

---

içində olar). (اُولٰٓئِكَ اَصْحَابُ النَّارِ هُمْ فِيهَا خَالِدُونَ) - **cəhənnəmin sahibləri onlardır və orada həmişəlik qalarlar.**

**28)** (وَيَوْمَ نَحْشُرُهُمْ جَمِيعًا) - **qiyamət günündə məxluqatın hamısını bir yerə cəm edərik.** (ثُمَّ نَقُولُ لِلَّذِينَ اَشْرَكُوا) - **ondan sonra müşriklərə deyərik:** (مَكَانَكُمْ اَنْتُمْ وَشُرَكَآؤُكُمْ) - **siz və şərikləriniz yerinizdə durun, baxın görün sizə nə olacaqdır?** (فَزَيَّلْنَا بَيْنَهُمْ) - **onlarla şəriklərinin arasına ayrılıq salıb bir-birilərindən kənar edərik.** (وَقَالَ شُرَكَآؤُهُمْ مَا كُنْتُمْ اِيَّانَا تَعْبُدُونَ) - **qiyamət günündə şəriklər müşriklərə deyərlər: "Siz bizə ibadət etməyib, bəlkə, şeytana ibadət edirdiniz.** (şeytanın və xəbis nəfsi-əmmarənin Allah-Təalaya şərik qoşmağı əmr etməsi şeytana ibadət etmək deməkdir).

**29)** (فَكَفٰى بِاللّٰهِ شَهِيدًا بَيْنَنَا وَبَيْنَكُمْ) - (yenə Allah-Təalaya şərik sayılanlar müşriklərə deyərlər:) (sizin bizə ibadətinizə agah olmadığımız haqda) **Allah-Təala bizimlə sizin aranızda şahid olaraq kifayət edər.** (اِنْ كُنَّا عَنْ عِبَادَتِكُمْ لَغَافِلِينَ) - **həqiqətən, biz sizin ibadətinizdən qafil idik.**

**30)** (هُنَالِكَ تَبْلُوا كُلُّ نَفْسٍ مَٓا اَسْلَفَتْ) – (bu sual-cavabdan sonra) **hər kəs özünün qabaqcadan göndərdiyi əməllərini tapar.** (وَرُدُّٓوا اِلَى اللّٰهِ مَوْلٰيهُمُ الْحَقِّ) - **həqiqi sahibləri olan Allah-Təalanın hüzuruna qaytarılıb** (onlara əzab olunar). (وَضَلَّ عَنْهُمْ مَا كَانُوا يَفْتَرُونَ) - **iftira edib** (Allah-Təalaya şərik saydıqları) **isə onlardan itib qeyb olar.**

**31)** (قُلْ مَنْ يَرْزُقُكُمْ مِنَ السَّمَٓاءِ وَالْاَرْضِ) - (ey Məhəmməd), **de ki, səmadan yağış göndərib, sizdən ötrü yer üzündə hər bir meyvə və bitkini əmələ gətirən kimdir?** (اَمَّنْ يَمْلِكُ السَّمْعَ وَالْاَبْصَارَ) – **bəs kimdir qulağa və gözlərə malik olan, onları yaratmağa kimin qüdrəti vardır?** (وَمَنْ يُخْرِجُ الْحَيَّ مِنَ الْمَيِّتِ) - **dirini ölüdən** (insan və heyvanı spermadan) **çıxaran kimdir?** (وَيُخْرِجُ الْمَيِّتَ مِنَ الْحَيِّ) - **və ölünü diridən** (spermanı insan və heyvandan) **çıxaran kimdir?** (وَمَنْ يُدَبِّرُ الْاَمْرَ) - **cəmi aləmləri tədbirlə idarə edən kimdir?** (فَسَيَقُولُونَ اللّٰهُ) – (ey Məhəmməd, sən müşriklərə bu sualları verəndə onlar sənin cavabında - bu şeylərin hamısını yaradan) **Allah-Təaladır, deyərlər.** (فَقُلْ اَفَلَا تَتَّقُونَ) – (onların

فَذٰلِكُمُ اللّٰهُ رَبُّكُمُ الْحَقُّۚ فَمَاذَا بَعْدَ الْحَقِّ اِلَّا الضَّلَالُۚ فَاَنّٰى تُصْرَفُونَ ﴿٣٢﴾ كَذٰلِكَ حَقَّتْ كَلِمَتُ
رَبِّكَ عَلَى الَّذِينَ فَسَقُوٓا اَنَّهُمْ لَا يُؤْمِنُونَ ﴿٣٣﴾ قُلْ هَلْ مِنْ شُرَكَٓائِكُمْ مَنْ يَبْدَؤُا الْخَلْقَ ثُمَّ يُعِيدُهُ
ۜ قُلِ اللّٰهُ يَبْدَؤُا الْخَلْقَ ثُمَّ يُعِيدُهُ فَاَنّٰى تُؤْفَكُونَ ﴿٣٤﴾ قُلْ هَلْ مِنْ شُرَكَٓائِكُمْ مَنْ يَهْدِيٓ اِلَى الْحَقِّۜ
قُلِ اللّٰهُ يَهْدِي لِلْحَقِّۜ

---

cavabında) **de:** (bir halda ki Allah-Təalanı bu şeylərin xaliqi sayırsınız,) **bəs niyə qorxub** (onun əzabından çəkinib, zəlaləti tərk edib hidayətə gəlmirsiniz?)

**32)** (فَذٰلِكُمُ اللّٰهُ رَبُّكُمُ الْحَقُّ) **- sizin haqq olan rəbbiniz** (bu qeyd olunan qüdrətin sahibi olan) **Allahdır,** (onun tərbiyəçi olması cəmi aləmlərdən ötrü haqla sabitdir. Diqqətlə baxan şəxslərdən ötrü onda heç bir şəkk və şübhə yoxdur)**.** (فَمَاذَا بَعْدَ الْحَقِّ اِلَّا الضَّلَالُ) **- haqdan sonra zəlalət və asi olmaqdan başqa nə vardır?** (Haqq olan Allah-Təaladan vaz keçəndən sonra şəxs zəlalət və asiliyə düçar olar. Çünki haqla batil arasında vasitə yoxdur. Haqdan keçən zəlalətə düşər)**.** (فَاَنّٰى تُصْرَفُونَ) **- bəs hara qayıdırsınız?** (Haqdan zəlalətə, tövhiddən şirkə, səadətdən bədbəxtliyə qayıdırsınız?)

**33)** (كَذٰلِكَ حَقَّتْ كَلِمَتُ رَبِّكَ عَلَى الَّذِينَ فَسَقُوٓا) – (ey Məhəmməd, Allah-Təalanın rəbb olması haqq olan kimi, küfr və şirklərində son dərəcə) **günahkar olan şəxslərin barəsində sənin rəbbin Allah-Təalanın hökmü haqq oldu.** (اَنَّهُمْ لَا يُؤْمِنُونَ) – (Allah-Təalanın hökmü budur ki, onlar öz ixtiyarları ilə küfrü tərk edib daha) **iman gətirən deyillər,** (bu səbəbdən Allah-Təala onlara əzab edəcəkdir)**.**

**34)** (قُلْ هَلْ مِنْ شُرَكَٓائِكُمْ مَنْ يَبْدَؤُا الْخَلْقَ ثُمَّ يُعِيدُهُ) – (ey Məhəmməd, müşriklərə) **de ki, bəs sizin Allah-Təalaya şərik qoşduqlarınız arasında eləsi var ki, məxluqatı əvvəlcə yaradıb,** (ikinci dəfə öləndən sonra qiyamət günündə) **yenə onu diriltsin** (buna qüdrəti olsun?) (قُلِ اللّٰهُ يَبْدَؤُا الْخَلْقَ ثُمَّ يُعِيدُهُ) - (onların inad və tərsliklərindən dillərində o qüvvə olmaz ki, haqq olan sözü desinlər. Ey Məhəmməd, onların əvəzinə cavab verib de ki, yox, o şəriklərdə heç bir güc və qüvvə yoxdur)**. Məxluqatı əvvəlcə yaradıb,** (ikinci dəfə öləndən sonra qiyamət günündə) **yenə onu** (diriltdib həyata) **qaytaran ancaq Allah-Təaladır.** (فَاَنّٰى تُؤْفَكُونَ) **- bəs onda hara meyil edirsiniz?** (Qadir olan Allah-Təaladan batil olan məbudların tərəfinə meyil edirsiniz?)

**35)** (قُلْ هَلْ مِنْ شُرَكَٓائِكُمْ مَنْ يَهْدِيٓ اِلَى الْحَقِّ) – (ey Məhəmməd, müşriklərə) **de ki, bəs sizin şəriklərinizdən elə biri var ki, xalqı haqq tərəfinə hidayət etsin?** (قُلِ اللّٰهُ يَهْدِي لِلْحَقِّ) - (ey Məhəmməd, onlar sənin bu sözünə cavab verməzlər, sən özün onların əvəzinə cavab verib) **de ki,** (xalqı) **haqqın tərəfinə hidayət edən sadəcə Allah-Təaladır.** (Ona görə ki, məsul olan insanlara ağıl verib və ağılın vasitəsilə, gərək, Haqqın yolunu dəlil və sübutla tapıb qorunsunlar.

اَفَمَنْ يَهْدِيٓ اِلَى الْحَقِّ اَحَقُّ اَنْ يُتَّبَعَ اَمَّنْ لَا يَهِدّٓي اِلَّٓا اَنْ يُهْدٰىۚ فَمَا لَكُمْ۠ كَيْفَ تَحْكُمُونَ ﴿٣٥﴾ وَمَا
يَتَّبِعُ اَكْثَرُهُمْ اِلَّا ظَنًّاۜ اِنَّ الظَّنَّ لَا يُغْنِي مِنَ الْحَقِّ شَيْـًٔاۜ اِنَّ اللّٰهَ عَلِيمٌ بِمَا يَفْعَلُونَ ﴿٣٦﴾ وَمَا كَانَ هٰذَا
الْقُرْاٰنُ اَنْ يُفْتَرٰى مِنْ دُونِ اللّٰهِ وَلٰكِنْ تَصْدِيقَ الَّذِي بَيْنَ يَدَيْهِ وَتَفْصِيلَ الْكِتَابِ لَا رَيْبَ فِيهِ مِنْ رَبِّ
الْعَالَمِينَ۠ ﴿٣٧﴾ اَمْ يَقُولُونَ افْتَرٰيهُۜ قُلْ فَاْتُوا بِسُورَةٍ مِثْلِهِ

---

Sizin şəriklərdə də bu xüsusiyyət varmı?) (اَفَمَنْ يَهْدِيٓ اِلَى الْحَقِّ اَحَقُّ اَنْ يُتَّبَعَ اَمَّنْ لَا يَهِدّٓي) – **bəs xalqı haqq tərəfinə hidayət edənə** (Allah-Təalaya) **tabe olmaq layiqdir? Yoxsa özünü hidayət etməyə qadir olmayıb hidayət tapmayan** (bütlər)**?** (اِلَّٓا اَنْ يُهْدٰى) - **şəriklər özlərini hidayət etməyə qadir deyil, gərək onları da Allah-Təala hidayət etsin.** (فَمَا لَكُمْ كَيْفَ تَحْكُمُونَ) – (ey ağılsız camaat)**, sizə nə olubdur, necə də hökm edib** (məxluqu və batil olan məbudları Allah-Təalaya şərik qoşarsınız?)

**36)** (وَمَا يَتَّبِعُ اَكْثَرُهُمْ اِلَّا ظَنًّا) - **müşriklərin çoxu** (rəisləri) **Allah-Təalanı iqrar etməkdə zənlərinə tabedir** (iqrarları elm üzrə deyil, əgər elm üzrə olsaydı, Allah-Təalaya şərik qoşmazdılar)**.** (اِنَّ الظَّنَّ لَا يُغْنِي مِنَ الْحَقِّ شَيْـًٔا) – **Allah-Təalanı bilməkdə zənn heç vaxt insanı elmdən ehtiyacsız etməz.** (Allah-Təalanı bilmək üçün elm lazımdır, ata-babanı təqlid edib zənnə tabe olmaqdan bütpərəstlik yarandı)**.** (اِنَّ اللّٰهَ عَلِيمٌ بِمَا يَفْعَلُونَ) - **həqiqətən Allah-Təala müşriklərin əməllərindən agahdır.** (Onlara öz əməllərinin cəzasını verəcəkdir)**.**

**37)** (وَمَا كَانَ هٰذَا الْقُرْاٰنُ اَنْ يُفْتَرٰى مِنْ دُونِ اللّٰهِ) - **və Quran Allah-Təaladan başqasının tərəfindəndir - demək səhih və dürüst iş deyildir.** (وَلٰكِنْ تَصْدِيقَ الَّذِي بَيْنَ يَدَيْهِ) - **bəlkə** (gərək belə deyilsin:) **bu Quran özündən əvvəlki kitabları təsdiq edəndir.** (وَتَفْصِيلَ الْكِتَابِ) - **bu Quran** (onda yazılan şəriət ehkamını) **təfsilatı ilə bəyan edəndir.** (لَا رَيْبَ فِيهِ مِنْ رَبِّ الْعَالَمِينَ) - **bu Quranın Allah-Təala tərəfindən olmasına şəkk və şübhə etmək layiq deyil. Bəlkə aləmlərin tərbiyəçisi, rəbbi olan Allah-Təaladan nazil olan bir kitabdır.**

**38)** (اَمْ يَقُولُونَ افْتَرٰيهُ) - **bəlkə** (bu müşriklər) - (Məhəmməd)**, bu Quranı özündən düzəldib, sonra Allah-Təalaya isnad edibdir, deyirlər?** (قُلْ فَاْتُوا بِسُورَةٍ مِثْلِهِ) - (ey Məhəmməd, müşriklərə) **de ki,** (əgər belədirsə, siz də mənim kimi ərəbcədə fəsahətli və bəlağətli şəxslərsiniz)**, bu Quranın misli kimi (nəzm və bəlağətdə ona oxşayan) bir surə də siz gətirin.***

*(*Qeyd: Ağıl sahibləri diqqətlə fikir verib Quranın haqq olduğunu bu ayədən anlasınlar, bu əhvalat Məkkədə vaqe olub, bütün Məkkə əhli, hətta Həmzədən başqa, peyğəmbərin bütün əmiləri də Hz. Peyğəmbərə düşmən idilər. Həmişə bu fikirdə idilər ki, bir bəhanə tapıb onu və dinini yer üzündən yox etsinlər. Hz. Peyğəmbər belə bir vəziyyətdə onlara qarşı belə bir iddia edir: əgər sizin gücünüz çatırsa, bu Quranın surələri kimi bir surə də siz gətirin ki, mənim sözlərimin batil və haqsız olduğu məlum*

وَادْعُوا مَنِ اسْتَطَعْتُمْ مِنْ دُونِ اللهِ اِنْ كُنْتُمْ صَادِقِينَ ﴿٣٨﴾ بَلْ كَذَّبُوا بِمَا لَمْ يُحِيطُوا بِعِلْمِهِ وَلَمَّا
يَاْتِهِمْ تَاْوِيلُهُ

---

*olsun. Bəs onların qüdrəti olsaydı, o kin və ədavətlə dayanıb baxardılar? Gücləri çatdığı halda, bu işi etməzdilər? Ağıllı şəxs bunu qəbul edərmi? Onların bir şey etməməsi və surə gətirməmələri onların Qurani-Şərifin müqabilində aciz olduqlarının dəlilidir. Bu iddia bir dəfə olmayıbdır. Neçə dəfə onların arasında bu sual-cavab olubdur, hər dəfə Hz. Peyğəmbərdən haqlı olmasına dair bir möcüzə istədiklərində peyğəmbər bu cavabı verib, onlar da aciz qalıblar).*

(O vaxt məlum olar ki, bu Quranı mən özümdən düzəltmişəm)**.** (وَادْعُوا مَنِ اسْتَطَعْتُمْ مِنْ دُونِ اللهِ اِنْ كُنْتُمْ صَادِقِينَ) **- əgər doğru deyirsinizsə, Allah-Təaladan başqa gücünüz çatan hər kəsi çağırın,** (onlar da sizə kömək olsunlar. Quran surəsi kimi bir surə gətirsə bilsəniz, o vaxt məlum olar ki, bu Quran Allah-Təaladan deyil, mən özümdən düzəltmişəm)**.**

**39)** (بَلْ كَذَّبُوا بِمَا لَمْ يُحِيطُوا بِعِلْمِهِ) **- bəlkə, Quranı eşidən kimi elmi mənasını*, həqiqətini qavramamış onu təkzib etdilər.** (وَلَمَّا يَاْتِهِمْ تَاْوِيلُهُ) **- Qurani-Şərifi düşünüb, yozumunu anlamadıqları halda, onu təkzib etdilər.**

*(*Qeyd: Bu şəkildə təkzib etmək aqillərin əməli deyil. Müşriklər öz cəhalətlərindən onların dinlərinə müxalif olub ata-babalarından təqlidlə öyrəndikləri hər şeyin ziddindən üz döndərərdilər. Bizim bu dövrdəki əksər müsəlmanların halı da belədir, əgər Qurani-Şərifin günəşdən işıqlı olan sözlərini onlara desən, ata-babadan təqlidlə qəbul etdikləri sözlərə xilaf olduğuna görə, eşidən kimi qaçarlar, necə ki digər heyvanlar şirdən qorxub qaçır. Bu məsələ sadəcə avam camaata məxsus deyil. Bəlkə, üləma cildindəki əksər insanların halı da belədir. İllərlə zəhmət çəkib müctəhid adlananlara xidmət edib, onlardan elm öyrənən şəxslərə də bir Qurani-Şərif ayəsi oxunsa, öyrəndiyi əslsiz qanunlara müxalif olduğu üçün, sanki, qəribə bir söz eşitmiş kimi olarlar. Hətta düşmənlər belə Quran ayələrinin mənasından istifadə etdikləri halda, onlar Qurandan bixəbər olub qaçmaq üçün bəhanə gətirib üzrxahlıq edərlər. O cümlədən - Quranın mənasını imamlardan başqa kim bilir? - deyib üsul qanunlarına dönərlər. Ya da əsl "bəraət"i (bir şeyin öncə pak və halal olmasını) iddia edib, haram və şübhəli olan vəqf və yetim malını asan loğma kimi udarlar və ya şübhəli şəkildə "istishab"a (şəxsin qeyb, yoxsa sağ sayılması halı) istinad edib 5 vaxt namazda imamın arxasında namaz qılanların mülkiyyəti haqqında hökm verərlər. Ya da "ümmətim xəta üzərində birləşməz" hədisini dəlil gətirib icma ilə Qurani-Şərifdə açıq şəkildə evlənmələrinə icazə verilən yetişkin qadınların evlənməsini qadağan edərlər. Və ya bəzi keçmiş üləmaların fitvasına əsaslanıb Qurani-Şərifdə açıq şəkildə qeyd edilən - arvadın ərindən miras alması barəsində olan hökmünü dəyişdirərlər. Hansı ki Qurana görə, əgər kişinin övladı olsa, arvada onun malının 8-də bir hissəsi, kişinin övladı olmasa, 4-də bir hissəsi düşər. Bu hökmü dəyişdirib, kişidən övladı olmayanda arvadı miras almaqdan məhrum edirlər. İslamın halına ağlamaq lazımdır, ehkama*

كَذٰلِكَ كَذَّبَ الَّذِينَ مِنْ قَبْلِهِمْ فَانْظُرْ كَيْفَ كَانَ عَاقِبَةُ الظَّالِمِينَ﴿٣٩﴾ وَمِنْهُمْ مَنْ يُؤْمِنُ بِهِ وَمِنْهُمْ مَنْ لَا يُؤْمِنُ بِهِ وَرَبُّكَ اَعْلَمُ بِالْمُفْسِدِينَ﴿٤٠﴾ وَاِنْ كَذَّبُوكَ فَقُلْ لِي عَمَلِي وَلَكُمْ عَمَلُكُمْ اَنْتُمْ بَرِيٓؤُنَ مِمَّآ اَعْمَلُ وَاَنَا بَرِيٓءٌ مِمَّا تَعْمَلُونَ﴿٤١﴾ وَمِنْهُمْ مَنْ يَسْتَمِعُونَ اِلَيْكَ اَفَاَنْتَ تُسْمِعُ الصُّمَّ وَلَوْ كَانُوا لَا يَعْقِلُونَ﴿٤٢﴾

---

*zidd edilən şeyləri yazmaqla qurtarmaz, ibrət alanlardan ötrü bu qədər də kifayət edər.* و في هذا غنية لالي الالباب */ Burda ağıl sahibləri üçün böyük ibrətlər var).*

(كَذٰلِكَ كَذَّبَ الَّذِينَ مِنْ قَبْلِهِمْ) – (ey Məhəmməd, bu müşriklər fikirləşmədən səni təkzib etdikləri kimi) **bunlardan əvvəlki ümmətlər də** (peyğəmbərləri və onlara nazil olan ayələri) **belə təkzib etdilər.** (فَانْظُرْ كَيْفَ كَانَ عَاقِبَةُ الظَّالِمِينَ) – (ey Məhəmməd)**, bax gör ki, o zalımların** (Nuh, Ad, Səmud camaatı) **aqibəti necə oldu?** (Gör onlara necə əzab göndərib həlak etdik? Sən də ey Məhəmməd, səbir et və müşrikləri, Məkkə əhlini də sənin əlində zəlil edəcəyik, onlara qalib olacaqsan. Bədir savaşında Hz. Peyğəmbər onlara qalib olub hamısı zəlil oldu)**.**

**40)** (وَمِنْهُمْ مَنْ يُؤْمِنُ بِهِ) (ey Məhəmməd)**, müşriklərdən bəzisi var ki,** (daxilən) **Quranı təsdiq edər,** (amma inadkarlıqdan təkzib edər. Necə ki Qüreyşin ən böyük var-dövlət sahibi olan Vəlid ibn Müğirə daxilən Quranı təsdiq etsə də, inadından inkar etdi)**.** (وَمِنْهُمْ مَنْ لَا يُؤْمِنُ بِهِ) **- müşriklərdən bəzisi də var ki, zahirən, həm daxilən Quranı təsdiq etmir,** (وَرَبُّكَ اَعْلَمُ بِالْمُفْسِدِينَ) – (ey Məhəmməd)**, sənin rəbbin inadkar və israrla inkar edən şəxslərdən agahdır.** (Onlara öz cəzalarını verəcəkdir)**.**

**41)** (وَاِنْ كَذَّبُوكَ) – (ey Məhəmməd)**, əgər bu müşriklər səni təkzib etməkdə** (israr edib möhkəm dursalar, sən də onların iman gətirmələrindən və sənin sözünü qəbul etmələrindən məyus olsan)**,** (فَقُلْ لِي عَمَلِي) – (onlardan əl çəkib kənar ol. Onlara) **de ki,** (iman gətirmədinizsə)**, mənim əməlim mənə,** (وَلَكُمْ عَمَلُكُمْ) **- sizin əməliniz sizə aiddir.** (اَنْتُمْ بَرِيٓؤُنَ مِمَّآ اَعْمَلُ) **- siz mənim əməllərimdən kənarsınız,** (وَاَنَا بَرِيٓءٌ مِمَّا تَعْمَلُونَ) **- mən də sizin əməllərinizdən kənaram.**

**42)** (وَمِنْهُمْ مَنْ يَسْتَمِعُونَ اِلَيْكَ) - (ey Məhəmməd)**, müşriklərdən bəzi şəxslər vardır ki,** (sən Quran oxuyub Allah-Təalanın hökmlərini xalqa bildirəndə) **sənə qulaq asarlar,** (lakin kar olan şəxslər kimi sanki qulaqlarına heç nə daxil olmamış kimi inanmazlar)**.** (اَفَاَنْتَ تُسْمِعُ الصُّمَّ وَلَوْ كَانُوا لَا يَعْقِلُونَ) – (ey Məhəmməd, bəs qulaqları haqq sözü eşitməkdən) kar olan və Qurani-Şərifin ayələrini) **düşünməyən şəxslərə** (ilahi ayələri) **eşitdirməyə qüdrətin var?** (Belə deyil, səndə o qüdrət yoxdur)**.**

**وَمِنْهُمْ مَنْ يَنْظُرُ اِلَيْكَۜ اَفَاَنْتَ تَهْدِي الْعُمْيَ وَلَوْ كَانُوا لَا يُبْصِرُونَ ﴿٤٣﴾ اِنَّ اللّٰهَ لَا يَظْلِمُ النَّاسَ شَيْـًٔا**
**وَلٰكِنَّ النَّاسَ اَنْفُسَهُمْ يَظْلِمُونَ ﴿٤٤﴾ وَيَوْمَ يَحْشُرُهُمْ كَاَنْ لَمْ يَلْبَثُوٓا اِلَّا سَاعَةً مِنَ النَّهَارِ يَتَعَارَفُونَ**
**بَيْنَهُمْۜ**

---

**43)** (وَمِنْهُمْ مَنْ يَنْظُرُ اِلَيْكَ) - (ey Məhəmməd)**, müşriklərdən bəzisi vardır ki, sənə baxıb** (doğruluq və peyğəmbərlik əlamətlərini səndə görürlər, amma təsdiq etmirlər)**.** (اَفَاَنْتَ تَهْدِي الْعُمْيَ وَلَوْ كَانُوا لَا يُبْصِرُونَ) – (ey Məhəmməd)**, bəs** (gözləri haqqı dərk etməkdən) **kor olan və bəsirəti olmayan şəxsləri hidayət etməyə qüdrətin var?** (Belə deyil, səndə o qüdrət yoxdur, şəxsin əgər qulağı olmasa, amma elm və şüur sahibi olsa, ağıl və fərasətlə bir şey dərk edər, habelə əgər şəxsin gözü olmasa, lakin qəlb gözü açıq olub, bəsirət sahibi olsa, bir şey dərk edə bilər. Amma bu müşriklərin nə ağlı var, nə də bəsirətləri, o səbəbə görə, heç bir şey dərk etməyib imandan kənar olublar)**.**

**44)** (اِنَّ اللّٰهَ لَا يَظْلِمُ النَّاسَ شَيْـًٔا) **- həqiqətən, Allah-Təala insanlara heç bir şəkildə zülm etməyib** (insanların faydasına və zamanın şərtlərinə görə peyğəmbər göndərib kitab nazil edər), (وَلٰكِنَّ النَّاسَ اَنْفُسَهُمْ يَظْلِمُونَ) **- lakin insanlar** (peyğəmbərləri təkzib edib, Allah-Təalanı inkar etdiklərindən) **özlərinə zülm edirlər.**

**45)** (وَيَوْمَ يَحْشُرُهُمْ) **-** (ey Məhəmməd)**, o günü yadına sal ki,* bütün insanların hamısını o gündə** (qiyamət günü) **haqq-hesabdan ötrü toplayarıq.** (كَاَنْ لَمْ يَلْبَثُوٓا اِلَّا سَاعَةً مِنَ النَّهَارِ) – **onlara** (axirətin müqabilində dünyada) **qalmaları, sanki, gündüz vaxtı bir saat kimi gələr** (sanki, dünyada az bir müddətdən artıq qalmayıblar. Dünyada insan nə qədər uzun ömür sürsə də, axirətin müqabilində ona bir saat kimi gələr)**.** (يَتَعَارَفُونَ بَيْنَهُمْ) – (qiyamət günündə) **insanlar bir-birilərini** (sanki, az bir müddət əvvəl ayrılmışlar kimi) **tanıyarlar,**

*(***Qeyd:** Müsəlmanlar bu ayəyə və bundan başqa, qiyamət barəsində zikr olunan ayələrə baxıb qiyamət gününü inkar etməsinlər, ayələri yozub zahiri mənasından ayrılmaq danışıq qanunundan kənar olmaqdır. Quran tapmaca və müəmma deyil, Quranın ucalığının bir işarəsi də onun xitablarının və kəlamlarının adət-ənənədən kənar olmamasıdır. Hər bir deyilən sözün aşkar olan zahiri mənasını qəbul etmək lazımdır. Quran da belədir, insan anlamadığı şeyi inkar etməməlidir, bizim bu dövrdə bəzi hikmət sahibləri, sənətkarlar elə şeylər yaradırlar ki, əgər daha əvvəl belə şeylərin nə vaxtsa olacağını desəydilər, xalq onları inkar edərdi. Allah-Təalanın işləri bundan da artıqdır. Ağıl onları dərk etmədiyindən inkar etmək nadanlıq əlamətidir. Avropa alimlərinin günəş və ayın və digər kürələrin məhv olması ilə dünya və içindəkilərin də yox olacağını demələri şəriət dilində ifadə edilən qiyamətin vaqe olacağına açıq-aşkar bir dəlil və rədd edilə bilməyən bir sübutdur).*

قَدْ خَسِرَ الَّذِينَ كَذَّبُوا بِلِقَآءِ اللّٰهِ وَمَا كَانُوا مُهْتَدِينَ ﴿٤٥﴾ وَاِمَّا نُرِيَنَّكَ بَعْضَ الَّذِي نَعِدُهُمْ اَوْ نَتَوَفَّيَنَّكَ فَاِلَيْنَا مَرْجِعُهُمْ ثُمَّ اللّٰهُ شَهِيدٌ عَلٰى مَا يَفْعَلُونَ ﴿٤٦﴾ وَلِكُلِّ اُمَّةٍ رَسُولٌۚ فَاِذَا جَآءَ رَسُولُهُمْ قُضِيَ بَيْنَهُمْ بِالْقِسْطِ وَهُمْ لَا يُظْلَمُونَ ﴿٤٧﴾ وَيَقُولُونَ مَتٰى هٰذَا الْوَعْدُ اِنْ كُنْتُمْ صَادِقِينَ ﴿٤٨﴾ قُلْ لَآ اَمْلِكُ لِنَفْسِي ضَرًّا وَلَا نَفْعًا اِلَّا مَا شَآءَ اللّٰهُۜ لِكُلِّ اُمَّةٍ اَجَلٌۜ اِذَا جَآءَ اَجَلُهُمْ فَلَا يَسْتَأْخِرُونَ سَاعَةً وَلَا يَسْتَقْدِمُونَ ﴿٤٩﴾

---

(قَدْ خَسِرَ الَّذِينَ كَذَّبُوا بِلِقَآءِ اللّٰهِ) - **həqiqətən, qiyamət gününü təkzib edib iman gətirməyənlər ziyankar olub, özlərinə zərər verdilər.** (وَمَا كَانُوا مُهْتَدِينَ) **- axirətə iman etməyə hidayət tapmadılar ki, nicat tapıb xeyir-mənfəətə qovuşsunlar.**

**46)** (وَاِمَّا نُرِيَنَّكَ بَعْضَ الَّذِي نَعِدُهُمْ) - (ey Məhəmməd), **dünyada müşriklərə vəd etdiyimiz əzabın bəzisini ya sənə göstərərik,** (necə ki Bədirdə və başqa yerlərdə göstərdik), (اَوْ نَتَوَفَّيَنَّكَ) – **ya da** (o əzabları sənə dünyada göstərməmiş) **səni vəfat etdirərik,** (o zaman da onların əzabını axirətdə sənə göstərərik). (فَاِلَيْنَا مَرْجِعُهُمْ) **- müşriklərin hamısının qayıdacağı yer bizim tərəfimizədir.** (Ölüm onları yaxalayıb, hamısı bizim tərəfimizə qayıdacaqdır). (ثُمَّ اللّٰهُ شَهِيدٌ عَلٰى مَا يَفْعَلُونَ) **- ondan sonra Allah-Təala onların dünyada etdiyi əməllərinə şahid olub,** (onun əvəzində onlara əzab edəcəkdir).

**47)** (وَلِكُلِّ اُمَّةٍ رَسُولٌ) **- hər bir ümmətdən ötrü bir peyğəmbər olubdur.** (Onlara göndərilib ki, onları Allah-Təalanın tövhidinə dəvət etsin). (فَاِذَا جَآءَ رَسُولُهُمْ) **–peyğəmbərləri gəlib onları haqq tərəfinə dəvət etdiyi zaman,** (قُضِيَ بَيْنَهُمْ بِالْقِسْطِ) – (dünya və axirətdə peyğəmbər ilə onu təkzib edənlərin) **arasında ədalət üzrə hökm olunub** (hər ikisində onlara – yalançılara əzab olunar). (وَهُمْ لَا يُظْلَمُونَ) – (peyğəmbərləri təkzib edən) **onlara zülm olunmaz.** (Ancaq öz əməllərinin cəzasını çəkərlər).

**48)** (وَيَقُولُونَ مَتٰى هٰذَا الْوَعْدُ اِنْ كُنْتُمْ صَادِقِينَ) - (ey Məhəmməd), **müşriklər sənə və möminlərə deyirlər: bizə vəd etdiyiniz o əzab nə vaxtdır?** (Əgər doğru deyənsinizsə, onun vaxtını bəyan edin).

**49)** (قُلْ لَآ اَمْلِكُ لِنَفْسِي ضَرًّا وَلَا نَفْعًا اِلَّا مَا شَآءَ اللّٰهُ) - (ey Məhəmməd, onların cavabında) **de ki, mən özümə nə bir zərər, nə də bir mənfəət yetirməyə malik və qadir deyiləm, ancaq Allah-Təalanın istəməsi istisnadır.** (Mən buna qadir deyiləmsə, sizdən ötrü əzab gətirməyə və onun vaxtını bəyan etməyə necə qadir olaram?) (لِكُلِّ اُمَّةٍ اَجَلٌ) **- hər bir ümmətin** (əzabından) **ötrü müəyyən bir vaxtı vardır.** (اِذَا جَآءَ اَجَلُهُمْ) **- əzablarının vaxtı yetişdiyi zaman,** (فَلَا يَسْتَأْخِرُونَ سَاعَةً وَلَا يَسْتَقْدِمُونَ) **- onun vaxtını nə bir saat təxirə sala, nə də bir saat qaba-**

قُلْ أَرَأَيْتُمْ إِنْ أَتَاكُمْ عَذَابُهُ بَيَاتًا أَوْ نَهَارًا مَاذَا يَسْتَعْجِلُ مِنْهُ الْمُجْرِمُونَ ﴿٥٠﴾ اَثُمَّ اِذَا مَا وَقَعَ اٰمَنْتُمْ
بِهٖ آٰلْـٰٔنَ وَقَدْ كُنْتُمْ بِهٖ تَسْتَعْجِلُونَ ﴿٥١﴾ ثُمَّ قِيلَ لِلَّذِينَ ظَلَمُوا ذُوقُوا عَذَابَ الْخُلْدِۚ هَلْ تُجْزَوْنَ اِلَّا
بِمَا كُنْتُمْ تَكْسِبُونَ﴿٥٢﴾ وَيَسْتَنْبِؤُنَكَ اَحَقٌّ هُوَۜ قُلْ اِي وَرَبّٖيٓ اِنَّهُ لَحَقٌّ وَمَآ اَنْتُمْ بِمُعْجِزِينَ۟﴿٥٣﴾
وَلَوْ اَنَّ لِكُلِّ نَفْسٍ ظَلَمَتْ مَا فِي الْاَرْضِ لَافْتَدَتْ بِهٖ وَاَسَرُّوا النَّدَامَةَ لَمَّا رَاَوُا الْعَذَابَۚ

---

**ğa çəkə bilərlər.** (Habelə siz müşriklərin də əzabından ötrü müəyyən bir vaxt vardır. O vaxt gecikməz)**.**

**50)** (قُلْ أَرَأَيْتُمْ) - (ey Məhəmməd)**, müşriklərə de ki, xəbər verin mənə,** (إِنْ أَتَاكُمْ عَذَابُهُ بَيَاتًا أَوْ نَهَارًا) **- əgər Allah-Təalanın əzabı siz gecə yatıb rahat olanda, ya da gündüz** (işinizlə məşğul olanda) **gəlsə,** (hər bir halda gəlsə, əzabın tez gəlməsinə peşman olacaqsınız)**.** (مَاذَا يَسْتَعْجِلُ مِنْهُ الْمُجْرِمُونَ) – (əzab acı olan bir şeydir)**, bəs günahkarlar niyə tələsib** (əzab) **istəyirlər?** (Müşriklər deyirdilər: əgər bu Quran haqdırsa, Allah-Təala bizə əzab göndərsin. Bu ayə onlara cavabdır. Yəni əzab elə bir şey deyil ki, insan onun üçün tələssin).

**51)** (اَثُمَّ اِذَا مَا وَقَعَ اٰمَنْتُمْ بِهٖ) **– əzabdan sonra Allah-Təalaya iman gətirəcəksiniz?** (O iman mənfəət verməz)**.** (آٰلْـٰٔنَ) **Yoxsa indi?** (Əzabı görüb, iman edəndən sonra, onlara deyilər: "İndiki imanın sizə heç bir mənfəəti yoxdur")**,** (وَقَدْ كُنْتُمْ بِهٖ تَسْتَعْجِلُونَ) **- halbuki həqiqətən, siz əzabı istəməkdə tələsirdiniz, (əzabı tez istəmək onun inkarına dəlildir, bəs indi əzabı görəndə iman gətirmək sizə nə fayda verər?**

**52)** (ثُمَّ قِيلَ لِلَّذِينَ ظَلَمُوا) – (Axirət günündə Allah-Təalanın əzabını inkar edib) **zalım olan şəxslərə** (əzab ediləndən) **sonra deyilər:** (ذُوقُوا عَذَابَ الْخُلْدِ) **- indi həmişəlik əzabı dadın.** (Heç vaxt sizdən ötrü qurtuluş yoxdur)**.** (هَلْ تُجْزَوْنَ اِلَّا بِمَا كُنْتُمْ تَكْسِبُونَ) **– sizə ancaq dünyada qazandığınız əməlləriniz səbəbinə cəza verilər.**

**53)** (وَيَسْتَنْبِؤُنَكَ اَحَقٌّ هُوَ) – (ey Məhəmməd, müşriklər) **səndən xəbər alırlar ki, bizə vəd etdiyin o əzab haqdır** (və vaqe olacaqmı? Bu sualı inkar və istehza üçün verdilər)**.** (قُلْ اِي وَرَبّٖيٓ اِنَّهُ لَحَقٌّ) **-** (ey Məhəmməd, onların cavabında) **de ki, bəli, and olsun mənim rəbbimə, həqiqətən, o əzab haqdır,** (vaqe olacaqdır)**.** (وَمَآ اَنْتُمْ بِمُعْجِزِينَ) **– əzabdan qaçıb,** (Allah-Təalanı aciz edən deyilsiniz, əlbəttə, o əzaba düçar olacaqsınız)**.**

**54)** (وَلَوْ اَنَّ لِكُلِّ نَفْسٍ ظَلَمَتْ مَا فِي الْاَرْضِ لَافْتَدَتْ بِهٖ) – (qiyamət günündə) **əgər hər bir zalım yer üzündə hər şeyə** (xəzinələrə və mənfəətlərə) **sahib olsa, onları verib əzabdan xilas olmaq istəyər,** (əlbəttə, ondan qəbul olunmayacaqdır)**.** (وَاَسَرُّوا النَّدَامَةَ لَمَّا رَاَوُا الْعَذَابَ) – (xəyal etmədiyi, yadına düşməyən) **əzabı görəndə daxilən peşman** (və çaşqın) **olub,** (bunu gizlədərlər, ağlamağa və danışmağa

وَقُضِيَ بَيْنَهُمْ بِالْقِسْطِ وَهُمْ لَا يُظْلَمُونَ﴿٥٤﴾ اَلَآ اِنَّ لِلّٰهِ مَا فِي السَّمٰوَاتِ وَالْاَرْضِ اَلَآ اِنَّ وَعْدَ
اللّٰهِ حَقٌّ وَلٰكِنَّ اَكْثَرَهُمْ لَا يَعْلَمُونَ﴿٥٥﴾ هُوَ يُحْيِي وَيُمِيتُ وَاِلَيْهِ تُرْجَعُونَ ﴿٥٦﴾ يَآ اَيُّهَا النَّاسُ قَدْ
جَآءَتْكُمْ مَوْعِظَةٌ مِنْ رَبِّكُمْ وَشِفَآءٌ لِمَا فِي الصُّدُورِ وَهُدًى وَرَحْمَةٌ لِلْمُؤْمِنِينَ ﴿٥٧﴾ قُلْ بِفَضْلِ اللّٰهِ
وَبِرَحْمَتِهِ فَبِذٰلِكَ فَلْيَفْرَحُواۜ هُوَ خَيْرٌ مِمَّا يَجْمَعُونَ ﴿٥٨﴾

---

gücləri olmaz). (وَقُضِيَ بَيْنَهُمْ بِالْقِسْطِ) – (qiyamət günündə zalımlarla məzlumların) **arasında ədalətlə hökm olunar.** (وَهُمْ لَا يُظْلَمُونَ) – (əlbəttə, zalım və məzlumun) **heç birinə zülm olunmaz,** (hər bir şəxsə öz əməlinin qarşılığı verilər).

**55)** (اَلَآ اِنَّ لِلّٰهِ مَا فِي السَّمٰوَاتِ وَالْاَرْضِ) – (ey Adəm övladı), **xəbərdar olun, həqiqətən, səmalarda və yerdə olan hər bir şey Allah-Təalanın mülküdür,** (və onları idarə etmək də Ona məxsusdur). (اَلَآ اِنَّ وَعْدَ اللّٰهِ حَقٌّ) **- yenə xəbərdar olun, həqiqətən, Allah-Təalanın** (əzab və savab) **hər bir vədi vaqe olacaqdır.** (وَلٰكِنَّ اَكْثَرَهُمْ لَا يَعْلَمُونَ) **- lakin məxluqatın çoxu bilməyib,** (Allah-Təalanın vədlərini cəhalətdən inkar edərlər).

**56)** (هُوَ يُحْيِي وَيُمِيتُ) **- dirildən və öldürən Allah-Təaladır.** (وَاِلَيْهِ تُرْجَعُونَ) – (hamınız öləndən sonra haqq-hesab və intiqamdan ötrü) **Allah-Təalanın tərəfinə dönüb qayıdacaqsınız.**

**57)** ( يَآ اَيُّهَا النَّاسُ قَدْ جَآءَتْكُمْ مَوْعِظَةٌ مِنْ رَبِّكُمْ) **- ey insanlar, həqiqətən, sizə rəbbiniz Allah-Təaladan öyüd-nəsihət** (Quran) **gəldi,** (وَشِفَآءٌ لِمَا فِي الصُّدُورِ) **- və o, sinələrdə olanın*** (cəhalətin, əxlaqsızlıq və batil etiqadların) **dərmanıdır** (və bu xəstəlikləri yox edər). (وَهُدًى وَرَحْمَةٌ لِلْمُؤْمِنِينَ) – (bu Quran) **ona iman gətirən şəxslərdən ötrü hidayət və rəhmətdir.**

*(*Qeyd: Həqiqətən də, belədir. İnsaf gözüylə baxanlar Qurani-Şərifdə olan gözəl vəsfləri və gözəl əxlaqı başqa heç bir kitabda görə bilməzlər. Bütün dünya alimlərinin və filosoflarının insanların həyatı və axirətinə dair yazdıqları kitablarda olan qanunların əsası və həqiqəti Qurani-Şərifin pak ayələri ilə bəyan olunubdur. Heyif ki, müsəlmanlar ancaq ölülərə axirət əzabından nicat vermək üçün Qurani-Şərifin qiraəti ilə məşğul olurlar. Əcəli gəlib ölən insanlara Qurani-Şərif oxumağın elə bir faydası yoxdur. Ancaq diri ikən ölü olan, iki ayaqlı, iki əlli, vəhşi təbiətli, məsuliyyətsiz məxluqların xəbis nəfslərinə həyat verən və onları dirilərin cərgəsinə daxil edən Qurani-Şərifdir. Zahirdə özlərinə Quran əhli deyib, Quranın ehkamını bildiklərini zənn edənlər Qurani-Şərifin ölü dirildən inci kimi parlaq sözləri ilə öz ölü nəfslərini dirildə bilmirlərsə, heyvani təbiətli sair avam məxluqatı zəlalət vadisindən xilas edib, hidayətə qovuşdurmaları çox müşkül məsələdir).*

**58)** (قُلْ بِفَضْلِ اللّٰهِ وَبِرَحْمَتِهِ فَبِذٰلِكَ فَلْيَفْرَحُوا) -(ey Məhəmməd, möminlərə) **de ki,** (əgər bir şeyə şad olsalar)**, gərək, Allah-Təalanın lütf və rəhmətinə şad olsunlar,** (ondan başqa şad olmağa layiq bir şey yoxdur). (هُوَ خَيْرٌ مِمَّا يَجْمَعُونَ)

قُلْ اَرَاَيْتُمْ مَٓا اَنْزَلَ اللّٰهُ لَكُمْ مِنْ رِزْقٍ فَجَعَلْتُمْ مِنْهُ حَرَامًا وَحَلَالًاۜ قُلْ اٰللّٰهُ اَذِنَ لَكُمْ اَمْ عَلَى اللّٰهِ تَفْتَرُونَ
﴿٥٩﴾ وَمَا ظَنُّ الَّذِينَ يَفْتَرُونَ عَلَى اللّٰهِ الْكَذِبَ يَوْمَ الْقِيَامَةِۜ اِنَّ اللّٰهَ لَذُو فَضْلٍ عَلَى النَّاسِ وَلٰكِنَّ
اَكْثَرَهُمْ لَا يَشْكُرُونَ۟ ﴿٦٠﴾ وَمَا تَكُونُ فِي شَاْنٍ وَمَا تَتْلُوا مِنْهُ مِنْ قُرْاٰنٍ وَلَا تَعْمَلُونَ مِنْ عَمَلٍ اِلَّا
كُنَّا عَلَيْكُمْ شُهُودًا اِذْ تُفِيضُونَ فِيهِۜ وَمَا يَعْزُبُ عَنْ رَبِّكَ مِنْ مِثْقَالِ ذَرَّةٍ فِي الْاَرْضِ وَلَا فِي السَّمَٓاءِ
وَلَا اَصْغَرَ مِنْ ذٰلِكَ وَلَا اَكْبَرَ اِلَّا فِي كِتَابٍ مُبِينٍ ﴿٦١﴾

---

**- onların topladığındansa** (fani dünya malındansa), **Allah-Təalanın lütf və rəhməti yaxşıdır.**

**59)** (قُلْ اَرَاَيْتُمْ مَٓا اَنْزَلَ اللّٰهُ لَكُمْ مِنْ رِزْقٍ) **-** (ey Məhəmməd)**, de ki, Allah-Təalanın sizdən ötrü göndərdiyi o ruzilərdən mənə xəbər verin,** (bəs onları sizə haram edibdirmi?) (فَجَعَلْتُمْ مِنْهُ حَرَامًا وَحَلَالًا) **- siz özünüz o ruzilərin bəzisini haram, bəzisini də halal edirsiniz.** (Necə ki ərəblər deyirdilər: “Filan dəvə, ya filan qoyun, ya filan əkin haramdır”, bu mətləb əvvəlki surələrdə qeyd olunubdur. Amma bu dövrün camaatı deyir: “İlahi, bizə Quranın halal etdiyi şeyləri rəhbərlər və din xadimləri haram etdilər”)**.** (قُلْ اٰللّٰهُ اَذِنَ لَكُمْ) **-** (ey Məhəmməd)**, onlara de ki, bəs halal və haram etməkdə Allah-Təala sizə izin veribdir?** (اَمْ عَلَى اللّٰهِ تَفْتَرُونَ) **- yoxsa Allah-Təalaya iftira edib deyirsiniz ki, bu halal, haramı Allah-Təala təyin edibdir** (yeməli şeylərdən haram olanları Allah-Təala Qurani-Şərifdə xəbər veribdir)**.**

**60)** (وَمَا ظَنُّ الَّذِينَ يَفْتَرُونَ عَلَى اللّٰهِ الْكَذِبَ يَوْمَ الْقِيَامَةِ) **- Allah-Təalaya iftira edib yalan isnad edənlərin qiyamət günü haqqında zənni, gümanı nədir?** (O günkü gündə hər bir şəxsin öz əməlinin qarşılığı ona veriləcəkdir. O iftira edənlər nicat tapacaqlarmı? Heyhat!)**.** (اِنَّ اللّٰهَ لَذُو فَضْلٍ عَلَى النَّاسِ) **- həqiqətən, Allah-Təala insanlara ehsan və lütf sahibidir. Onlara ağıl verib və peyğəmbər göndərib, halal və haramı onlardan ötrü bəyan edibdir.** (وَلٰكِنَّ اَكْثَرَهُمْ لَا يَشْكُرُونَ) **- lakin məxluqatın çoxu** (Allah-Təalanın hidayətinə tabe olmayıb onun verdiyi nemətlərə) **şükür etməzlər.**

**61)** (وَمَا تَكُونُ فِي شَاْنٍ) **-** (ey Məhəmməd, xüsusən) **sən özün elə bir işdə və əməldə olmazsan ki** (وَمَا تَتْلُوا مِنْهُ مِنْ قُرْاٰنٍ) **- sənə nazil olan Qurandan elə bir şey oxumazsan ki,** (وَلَا تَعْمَلُونَ مِنْ عَمَلٍ) **- və siz insanlar elə bir əməl etməzsiniz ki,** (اِلَّا كُنَّا عَلَيْكُمْ شُهُودًا اِذْ تُفِيضُونَ فِيهِ) – (sən peyğəmbər və siz insanlar) **elə bir əmələ dalmazsınız ki, biz özümüz sizin o əməllərinizə şahid olmayaq,** (heç bir əməliniz bizim elmimizdən kənar qalmaz. Bütün əməllərinizə xəbərdar və agahıq)**.** (وَمَا يَعْزُبُ عَنْ رَبِّكَ مِنْ مِثْقَالِ ذَرَّةٍ فِي الْاَرْضِ وَلَا فِي السَّمَٓاءِ) – (ey Məhəmməd)**, nə yerdə, nə də səmada zərrə ağırlığında bir şey sənin rəbbin Allah-Təalanın elmindən qaib olmaz.** (لَا اَصْغَرَ مِنْ ذٰلِكَ وَلَا اَكْبَرَ اِلَّا فِي كِتَابٍ مُبِينٍ) **- zərrədən nə**

اَلَا اِنَّ اَوْلِيَٓاءَ اللّٰهِ لَا خَوْفٌ عَلَيْهِمْ وَلَا هُمْ يَحْزَنُونَۚ ﴿٦٢﴾ اَلَّذِينَ اٰمَنُوا وَكَانُوا يَتَّقُونَۜ ﴿٦٣﴾ لَهُمُ
الْبُشْرٰى فِي الْحَيٰوةِ الدُّنْيَا وَفِي الْاٰخِرَةِۜ لَا تَبْدِيلَ لِكَلِمَاتِ اللّٰهِۜ ذٰلِكَ هُوَ الْفَوْزُ الْعَظِيمُۜ ﴿٦٤﴾ وَلَا
يَحْزُنْكَ قَوْلُهُمْۢ اِنَّ الْعِزَّةَ لِلّٰهِ جَمِيعًاۜ هُوَ السَّمِيعُ الْعَلِيمُ ﴿٦٥﴾ اَلَٓا اِنَّ لِلّٰهِ مَنْ فِي السَّمٰوَاتِ وَمَنْ فِي
الْاَرْضِۜ وَمَا يَتَّبِعُ الَّذِينَ يَدْعُونَ مِنْ دُونِ اللّٰهِ شُرَكَٓاءَۜ

---

**kiçik, nə də böyük elə bir şey yoxdur ki, lövhi-məhfuzda** (Allah-Təalanın elmində) **qeyd olunmuş olmasın.**

**62)** (اَلَا اِنَّ اَوْلِيَٓاءَ اللّٰهِ لَا خَوْفٌ عَلَيْهِمْ وَلَا هُمْ يَحْزَنُونَ) **- xəbərdar olun ki, Allah-Təalanı dost tutan** (ona itaət edən) **şəxslərə** (qiyamət günündə) **qorxu yoxdur. Məhzun və qəmgin də olmazlar.** (Necə ki Allah-Təalanın düşmənləri qorxu içində olub məhzun olacaqlar)**.**

**63)** (اَلَّذِينَ اٰمَنُوا وَكَانُوا يَتَّقُونَ) **– Allah-Təalanın dostları o şəxslərdir ki, ona iman gətirib, qorxu içində olarlar.** (O qorxu səbəbinə günahı tərk edib, Allaha itaət edərlər)**.**

**64)** (لَهُمُ الْبُشْرٰى فِي الْحَيٰوةِ الدُّنْيَا وَفِي الْاٰخِرَةِ) **– onlardan ötrü həm dünya həyatında müjdə vardır,** (necə ki Qurani-Şərifdə neçə yerdə xəbər veribdir ki, mömin və müttəqilərdən ötrü cənnəti hazır etmişəm), **həm də axirətdə qiyamət günündə,** (qiyamət günü möminlərə müjdə verilər ki, sizə heç bir qorxu yoxdur. Rəhmətim sizə şamil olub, sizə əzabdan nicat vermişəm)**.** (لَا تَبْدِيلَ لِكَلِمَاتِ اللّٰهِ) **- Allah-Təalanın sözlərində heç bir dəyişiklik yoxdur,** (əzab, ya da rəhmət, hökm buyurulan hər şey vaqe olacaqdır)**.** (ذٰلِكَ هُوَ الْفَوْزُ الْعَظِيمُ) **–** (dünya və axirətdə nicat tapmaq) **böyük əcr və savaba yetişməkdir.**

**65)** (وَلَا يَحْزُنْكَ قَوْلُهُمْ) **– (ey Məhəmməd), bu müşriklərin sözləri** (səni təkzib edib qorxutmaları və səni öldürmək üçün tədbir görüb, məşvərət etmələri) **səni məhzun və qəmgin etməsin.** (اِنَّ الْعِزَّةَ لِلّٰهِ جَمِيعًا) **- həqiqətən, izzət və qələbənin hamısı Allah-Təalaya məxsusdur.** (Onlar sənə qalib ola bilməzlər. Allah-Təala sənə kömək olub, onlara qalib edəcəkdir)**.** (هُوَ السَّمِيعُ الْعَلِيمُ) **- Allah-Təala** (müşriklərin danışdığı sözləri) **eşidib,** (səni qətl etmək üçün gördükləri tədbirdən) **agahdır.** (Məkkədə müşriklər Hz. Peyğəmbəri öldürmək üçün toplanıb, məşvərət etdilər, Allah-Təala onların əməlini peyğəmbərinə xəbər verir)**.**

**66)** (اَلَٓا اِنَّ لِلّٰهِ مَنْ فِي السَّمٰوَاتِ وَمَنْ فِي الْاَرْضِ) **- xəbərdar olun ki, səmalarda və yerdə olanların** (ağıl sahibləri, mələklərin) **hamısı, həqiqətən, Allah-Təalanındır** (Onun qulu və onun ixtiyarındadırlar. Ağıl sahiblərinin başqa şeyləri Allah-Təalaya şərik qoşması layiq deyil)**.** (وَمَا يَتَّبِعُ الَّذِينَ يَدْعُونَ مِنْ دُونِ اللّٰهِ شُرَكَٓاءَ) **- o şəxslər ki Allah-Təaladan başqa şəriklərə dua edib, onlara ibadət**

اِنْ يَتَّبِعُونَ اِلَّا الظَّنَّ وَاِنْ هُمْ اِلَّا يَخْرُصُونَ ﴿٦٦﴾ هُوَ الَّذِي جَعَلَ لَكُمُ الَّيْلَ لِتَسْكُنُوا فِيهِ وَالنَّهَارَ
مُبْصِرًاۜ اِنَّ فِي ذٰلِكَ لَاٰيَاتٍ لِقَوْمٍ يَسْمَعُونَ ﴿٦٧﴾ قَالُوا اتَّخَذَ اللّٰهُ وَلَدًا سُبْحَانَهُۜ هُوَ الْغَنِيُّۜ لَهُ مَا فِي
السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِۜ اِنْ عِنْدَكُمْ مِنْ سُلْطَانٍ بِهٰذَاۜ اَتَقُولُونَ عَلَى اللّٰهِ مَا لَا تَعْلَمُونَ ﴿٦٨﴾ قُلْ
اِنَّ الَّذِينَ يَفْتَرُونَ عَلَى اللّٰهِ الْكَذِبَ لَا يُفْلِحُونَۜ ﴿٦٩﴾ مَتَاعٌ فِي الدُّنْيَا ثُمَّ اِلَيْنَا مَرْجِعُهُمْ ثُمَّ نُذِيقُهُمُ
الْعَذَابَ الشَّدِيدَ بِمَا كَانُوا يَكْفُرُونَ ﴿٧٠﴾

---

**edirlər, həqiqətdə, onlara tabe olmurlar,** (اِنْ يَتَّبِعُونَ اِلَّا الظَّنَّ) **- bəlkə ancaq zənnə tabe olub,** (bütlərin Allah-Təalaya şərik olduğunu həqiqət üzrə yox, zənn üzrə qəbul ediblər). (وَاِنْ هُمْ اِلَّا يَخْرُصُونَ) **- o müşriklər bütlərin Allah-Təalaya şərik olduğunu özlərindən düzəldib qoşurlar.**

**67)** (هُوَ الَّذِي جَعَلَ لَكُمُ الَّيْلَ لِتَسْكُنُوا فِيهِ) **- Allah Təala kamil qüdrəti ilə zəhmətdən rahat olasınız deyə sizdən ötrü gecəni yaradıbdır.** (وَالنَّهَارَ مُبْصِرًا) – (ruzinizi qazanasınız deyə) **gündüzü sizdən ötrü işıqlı edibdir.** (اِنَّ فِي ذٰلِكَ لَاٰيَاتٍ لِقَوْمٍ يَسْمَعُونَ) – **bunda** (gecə-gündüzdə Allah-Təalanın sözlərinə) **qulaq asan,** (ibrət alan və aləmlərin yeganə yaradıcısının Allah-Təala olduğuna agah olan) **camaatdan ötrü dəlil və sübutlar vardır.**

**68)** (قَالُوا اتَّخَذَ اللّٰهُ وَلَدًا) - (xristianlar deyən kimi) **müşriklər də dedilər: "Allah-Təala özündən ötrü mələkləri övlad** (qız) **götürübdür.** (سُبْحَانَهُ) **- Allah-Təala özünə övlad götürməkdən pak və müqəddəsdir,** (nə axmaq söz deyirlər), (هُوَ الْغَنِيُّ) **– heç kimə möhtac olmayan Odur,** (belə şəxsə övlad niyə lazımdır?) (لَهُ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِ) **- səmalarda və yerdə olan hər bir şey Allah-Təalanın mülküdür,** (onlara malik olduğu üçün övlada ehtiyacı yoxdur). (اِنْ عِنْدَكُمْ مِنْ سُلْطَانٍ بِهٰذَا) **- yanınızda bu dediyiniz sözə** (Allah-Təala özü üçün övlad götürüb - sözünə) **bir dəlil və sübut yoxdur.** (اَتَقُولُونَ عَلَى اللّٰهِ مَا لَا تَعْلَمُونَ) **bəs** (Allah-Təalaya o sözü isnad edib) **deyirsiniz ki, ona agah deyilsiniz?** (dəlil və sübutsuz deyilən hər bir sözün sahibinə cahil demək doğrudur).

**69)** (قُلْ اِنَّ الَّذِينَ يَفْتَرُونَ عَلَى اللّٰهِ الْكَذِبَ) - (ey Məhəmməd), **de ki, o şəxslər ki, Allah-Təalaya** (iftira edib), **yalan isnad edib,** (Ona övlad nisbət edənlər), (لَا يُفْلِحُونَ) **- axirət əzabından nicat tapmazlar.**

**70)** (مَتَاعٌ فِي الدُّنْيَا) – (onların Allah-Təalaya etdikləri bu iftiraları) **dünya mənfəətidir.** (Ta ki xalqı aldadıb, onlara hakim olsunlar). (ثُمَّ اِلَيْنَا مَرْجِعُهُمْ) – (onları – rəhbərləri ölüm yaxalayandan) **sonra qayıdacaqları yer bizim tərəfimizdədir.** (ثُمَّ نُذِيقُهُمُ الْعَذَابَ الشَّدِيدَ بِمَا كَانُوا يَكْفُرُونَ) **- ondan sonra Allah-Təalaya kafir olduqları** (övlad isnad etdikləri) **üçün** (qiyamət günündə) **şiddətli od əzabını onlara dadızdırarıq.**

وَاتْلُ عَلَيْهِمْ نَبَاَ نُوحٍۢ اِذْ قَالَ لِقَوْمِه۪ يَا قَوْمِ اِنْ كَانَ كَبُرَ عَلَيْكُمْ مَقَام۪ي وَتَذْك۪يرِي بِاٰيَاتِ اللّٰهِ فَعَلَى اللّٰهِ تَوَكَّلْتُ فَاَجْمِعُوٓا اَمْرَكُمْ وَشُرَكَٓاءَكُمْ ثُمَّ لَا يَكُنْ اَمْرُكُمْ عَلَيْكُمْ غُمَّةً ثُمَّ اقْضُوا اِلَيَّ وَلَا تُنْظِرُونِ ﴿٧١﴾ فَاِنْ تَوَلَّيْتُمْ فَمَا سَاَلْتُكُمْ مِنْ اَجْرٍ

---

**71)** (وَاتْلُ عَلَيْهِمْ نَبَاَ نُوحٍ) - (ey Məhəmməd), **Nuh** (peyğəmbərin) **xəbərini** (xalqa) **oxu,** (bəlkə ibrət alıb, Allah-Təalaya şərik qoşmayıb, müvəhhid olsunlar). (اِذْ قَالَ لِقَوْمِه۪ يَا قَوْمِ) **- o zaman ki, xitab edib öz qövmünə belə dedi: ey mənim qövmüm,** (اِنْ كَانَ كَبُرَ عَلَيْكُمْ مَقَام۪ي وَتَذْك۪يرِي بِاٰيَاتِ اللّٰهِ) **- əgər sizə mənim aranızda olmağım və Allah-Təalanın ayə və ehkamlarını sizə deməyim ağır gəlirsə,** (mənim qətlimə əzm etdiyinizə görə, sizdən qorxum yoxdur). (فَعَلَى اللّٰهِ تَوَكَّلْتُ) **- mən Allah-Təalaya təvəkkül etmişəm,** (inam və etimadım Onadır. O, mənə kifayət edər). (فَاَجْمِعُوٓا اَمْرَكُمْ وَشُرَكَٓاءَكُمْ) **- Allah-Təalaya ortaq qoşduğunuz şəriklərinizin köməyi ilə toplanıb işinizi** (məni qətl, ya da sürgün) **edin.** (ثُمَّ لَا يَكُنْ اَمْرُكُمْ عَلَيْكُمْ غُمَّةً) **- ondan sonra sizin bu işiniz** (məni qətlə yetirmək) **sizdən ötrü ağır bir qəm və qüssə olmasın.** (Bu barədə heç fikir etməyin). (ثُمَّ اقْضُوا اِلَيَّ وَلَا تُنْظِرُونِ) **- ondan sonra mənə əzm etdiyiniz işi edib, mənə möhlət verməyin.** (Öldürülməkdən qorxmuram).

**72)** (فَاِنْ تَوَلَّيْتُمْ) **- əgər mənim öyüd-nəsihətimdən üz döndərsəniz,** (sizdən soruşaram: bu üz döndərməyin səbəbi nədir?) (فَمَا سَاَلْتُكُمْ مِنْ اَجْرٍ) **(məndə elə bir şey yoxdur ki, ondan nifrət edib qaçasınız, malınızda da tamahım yoxdur). Öyüd-nəsihət üçün sizdən əcr və mükafat* da istəmirəm, (bəs niyə məndən qaçırsınız?)**

*(*Qeyd: Bəli, biz İslam üləmalarını xalqın gözündən düşürən və Allah-Təalanın yanında etibardan salan vəz, nəsihət üçün əcr almağımızdır. Allah-Təala bu xəstəliyi bizdən dəf etsin. İbadətxanalar zahirdə məscid, batində alış-veriş məkanı, hətta cibgirlik və adam soymaq yeri olubdur. Elə ki Allah-Təalanın mübarək Ramazan ayı gəlir, xalqı məscidə gəlib ibadətə təşviq edərik, lakin daxilən 100 cür hiylə və yalan fikirləşərik ki, necə edək ki, bu il qazancımız artıq olsun. Ey mənim din qardaşlarım, bu sözlər xətrinizə dəyməsin. Mən də sizinlə bu dərdə şərikəm, Allah-Təaladan bu əməlin tərk edilməsi üçün yardım istəyirəm. Siz də mənimlə eyni fikirdə olub bu qəbih əməli tərk eləyin, pendir-çörəklə kifayətlənin, əgər siz bu əməli tərk etsəniz, xalq da Allah-Təalaya və onun peyğəmbərinə iftira edən yalançı birinin adını mərsiyəxan qoyub, minbərə çıxarıb, onun başına yığılmaz. Onlar da min bir oyunbazlıqla xalqı aldadıb, Hz. Peyğəmbərin göz nuru olan Hz. Hüseynin qətlini və onun ailəsinin təhqir edilməsini özlərindən ötrü həyat sərmayəsi etməzlər. Əgər biz az olan dünya malından vaz keçə bilsək, hər halda bu zəlil insanlar yalan sözlərlə xalqın malını əlindən ala bilməzlər. Vallah, bu insanların əməlləri əsl müsəlmanların ürəyini parçalayır, zülmə məruz qalan Hz. Hüseynə, onun nurlu ailəsinə və yoldaşlarına ağlamaq əvəzinə, gərək, bu yalançıların pak əhli-beytə etdiyi zülmlərə ağlayaq, nə vaxtadək biz qəflət yuxu-*

إِنْ أَجْرِيَ إِلَّا عَلَى اللَّهِ ۖ وَأُمِرْتُ أَنْ أَكُونَ مِنَ الْمُسْلِمِينَ ﴿٧٢﴾

*sunda qalıb adımız alim, özümüz insan cildindəki heyvan kimi dolanacağıq. Məscid və minbərləri xəbis əməllərlə murdarlayıb, insanların namaz və oruclarının batil olmasına bais olacağıq? Nə vaxtadək özümüzü bilməməzliyə qoyub, belə pis əməllərə göz yumacağıq? Nə vaxta qədər lotular gəlib müsəlmanların minbərlərinə çıxıb, yerin və səmaların fövqündə olan Allahın cənnətini az bir məbləğə şəxsi mülk kimi satacaqlar? Biz də minbərin müqabilində oturub gözümüzü onların ağzına dikib, ağızlarından çıxan duaları vəhy kimi qəbul edəcəyik? Ey müsəlmanlar, başqalarından eşidən bir qulaq və görən bir göz alıb baxıb, görün ki, hansı dinin və millətin ibadətxanalarında bizdəki kimi bu cür ədəbsiz əməllər edirlər? Baxıb görün, bu mərsiyəxan tayfası xalqı necə günahkar edir? Minbərdə nə etsələr də, xalq onları həqiqət kimi qəbul edib, etiraz edəni də təkfir edirlər. Mən həqir ilk gənclik illərimdə bir dəfə Məhərrəm ayının 8-də gecə vaxtı məscidlərdən birinə getdim. Əvvəllər tiryəkbaz dərviş olub, ondan sonra bizim Bakı şəhərinə gəlib mərsiyəxan olan yalançı bir şəxs gəlib minbərə çıxdı. Növhəxanlıq edib, ağlayıb, xalqı da ağlamağa təşviq etdi, üst-başını cırıb, araba təkəri böyüklüyündəki seyidlik əmmaməsini yerə çırpıb, camaatın arasına vay-şivən saldı. İnsanlardan neçə nəfər qəşş edib məsciddən aparıldı. Amma imam Hüseynin o dindar baş nökərinin öz gözündən bir qətrə də yaş axmadı. Bir saat keçəndən sonra sakitləşib, xalq da rahat oldu. Başladı ki, ey camaat, hər il bir gecə imam Hüseyn üçün bərat gecəsidir, bu gecə də bərat gecəsidir. Görək ağamız imam Hüseyni özünüzdən necə razı edəcəksiniz, ay qurban olum qeyrətinizə, vallah, xalis şiəsiniz. O anda camaatın arasında bir qəribə qarışıqlıq meydana gəldi. Hər kəs öz imkanından da artıq pul verməyə başladı. Minbərdə olan cahil pulun məbləğini düşünəndə sevincindən cuşa gəlib dedi: "Xəstələndim, mənə bir qəlyan gətirin." O saat onun əmrini Allah-Təalanın əmrindən də vacib sayıb, qəlyanı gətirdilər. Minbərin üstündə bir tərəfdən dua edib, xalqın ölülərini cənnətə göndərib, digər tərəfdən xalqı coşdurub xorultuyla qəlyan çəkməyə davam etdi. Bəs budur islamın qanunu? İslam ibadətxanalarında, gərək, bu cür hərəkət etməyək. Hz. Nuh peyğəmbərin sözünə fikir verilsə, o vaxt məlum olar ki, üləmanın sözlərinin təsirsiz olmasının səbəbi hər öyüd-nəsihət üçün əcr, mükafat almalarıdır. Bu vaxtadək ömrümüzü qəflətdə keçirmişik, bundan sonra gərək səmimi-qəlbdən və ixlasla islamı yaymağa çalışaq, ey mənim qardaşlarım, ey üləmalar, gəlin bu işdən tövbə edib, Allah-Təalaya yalvaraq. Mən həqir tövbə edib, Allah-Təaladan xahiş edirəm ki, bundan əvvəl cahilliklə keçən ömürlərimizi bağışlasın və bizə yardım etsin ki, onun yolunda sadiqcəsinə xidmət edək. Amin, bu mətləbin təfsilatı bu kitabda Şüəra surəsinin təfsirində Hz. Peyğəmbərin təbliğ müqabilində əcr və mükafat istəməməsi mövzusunda inşallah, qeyd olunacaq).*

(إِنْ أَجْرِيَ إِلَّا عَلَى اللَّهِ) (Nuh deyir:) **- mənim əcr və mükafatım ancaq Allah-Təaladandır,** (sizdən bir şey xahiş etmirəm)**.** (وَأُمِرْتُ أَنْ أَكُونَ مِنَ الْمُسْلِمِينَ) **- Allah-Təala tərəfindən o müsəlmanlardan olmağa əmr olunmuşam ki,** (ilahi ehkamı təbliğ etməkdə məqsədi dünya malı olmayıb, əvəzində bir şey almasın)**.**

فَكَذَّبُوهُ فَنَجَّيْنَاهُ وَمَنْ مَعَهُ فِي الْفُلْكِ وَجَعَلْنَاهُمْ خَلَائِفَ وَأَغْرَقْنَا الَّذِينَ كَذَّبُوا بِآيَاتِنَا ۖ فَانْظُرْ كَيْفَ
كَانَ عَاقِبَةُ الْمُنْذَرِينَ ﴿٧٣﴾ثُمَّ بَعَثْنَا مِنْ بَعْدِهِ رُسُلًا إِلَىٰ قَوْمِهِمْ فَجَاءُوهُمْ بِالْبَيِّنَاتِ فَمَا كَانُوا لِيُؤْمِنُوا
بِمَا كَذَّبُوا بِهِ مِنْ قَبْلُ ۚ كَذَٰلِكَ نَطْبَعُ عَلَىٰ قُلُوبِ الْمُعْتَدِينَ ﴿٧٤﴾ ثُمَّ بَعَثْنَا مِنْ بَعْدِهِمْ مُوسَىٰ وَهَارُونَ
إِلَىٰ فِرْعَوْنَ وَمَلَئِهِ بِآيَاتِنَا فَاسْتَكْبَرُوا وَكَانُوا قَوْمًا مُجْرِمِينَ ﴿٧٥﴾ فَلَمَّا جَاءَهُمُ الْحَقُّ مِنْ عِنْدِنَا قَالُوا
إِنَّ هَٰذَا لَسِحْرٌ مُبِينٌ﴿٧٦﴾

---

**73)** (فَكَذَّبُوهُ) – **Nuh peyğəmbəri** (öz qövmü) **təkzib edib onun sözünə qulaq asmadı.** (Bəli, hər bir dövrdə belə olubdur. İlahi ehkamı, rüşvət almayıb, düz olan şəxsləri təkzib edib, amma hiyləgər, rüşvətxor, yalançı şəxslərin sözlərini vəhy kimi qəbul edib təsdiq edərlər). (فَنَجَّيْنَاهُ وَمَنْ مَعَهُ فِي الْفُلْكِ) – (Nuhun qövmünü tufana düçar edib)**, ona və** (iman gətirib) **onunla birlikdə gəmidə olan şəxslərə nicat verdik.** (وَجَعَلْنَاهُمْ خَلَائِفَ) – **onları** (nicat verilənləri qərq olanlara) **varis etdik.** (وَأَغْرَقْنَا الَّذِينَ كَذَّبُوا بِآيَاتِنَا) – **ayələrimizi təkzib edənləri isə qərq etdik.** (فَانْظُرْ كَيْفَ كَانَ عَاقِبَةُ الْمُنْذَرِينَ) - (ey Məhəmməd)**, bax gör ki,** (peyğəmbər tərəfindən) **qorxudulanların** (ona itaət etməyənlərin) **aqibəti necə oldu?** (Ey Məhəmməd, səni də təkzib edənlər onlara əzab nazil olmaqdan çəkinsinlər)**.**

**74)** (ثُمَّ بَعَثْنَا مِنْ بَعْدِهِ رُسُلًا إِلَىٰ قَوْمِهِمْ) - **Nuhdan sonra öz qövmlərinə peyğəmbərlər** (Hud, Saleh, İbrahim, Lut və bunlardan başqalarını) **göndərdik.** (فَجَاءُوهُمْ بِالْبَيِّنَاتِ) – (o peyğəmbərlər peyğəmbərliklərini sübut edən) **açıq-aşkar dəlillərlə onlara** (öz qövmlərinə) **gəldilər.** (فَمَا كَانُوا لِيُؤْمِنُوا بِمَا كَذَّبُوا بِهِ مِنْ قَبْلُ) – **amma daha əvvəl təkzib etdiklərinə** (peyğəmbər gəlmədən əvvəl cahiliyyə zamanında haqq sözlərə) **iman gətirməyib** (yenə təkzib etdilər. Peyğəmbərin gəlib-gəlməməsinin onların halında heç bir fərqi olmayıb, sanki, onlara heç bir peyğəmbər gəlməmişdi)**.** (كَذَٰلِكَ نَطْبَعُ عَلَىٰ قُلُوبِ الْمُعْتَدِينَ) – (iman gətirməyənlər kimi qəlbləri möhürlənib)**, həddi aşıb, Allah-Təalaya asi olanların qəlblərinə elə bir möhür vurarıq** (ki, bir də heç vaxt öz ixtiyarları ilə iman gətirməzlər)**.**

**75)** (ثُمَّ بَعَثْنَا مِنْ بَعْدِهِمْ مُوسَىٰ وَهَارُونَ إِلَىٰ فِرْعَوْنَ وَمَلَئِهِ بِآيَاتِنَا) - **o peyğəmbərlərdən sonra Musa ilə Harunu aşkar olan möcüzələrimizlə firona və onun əyanlarına göndərdik.** (فَاسْتَكْبَرُوا وَكَانُوا قَوْمًا مُجْرِمِينَ) – (möcüzələri qəbul edib Musa və Harunu peyğəmbərliyini təsdiq etməkdə) **təkəbbür etdilər. Kafir və günahkar bir camaat idilər.**

**76)** (فَلَمَّا جَاءَهُمُ الْحَقُّ مِنْ عِنْدِنَا) – **onlara** (firon və onun qövmünə) **bizim tərəfimizdən haqq olan möcüzə gəldiyində,** (قَالُوا إِنَّ هَٰذَا لَسِحْرٌ مُبِينٌ) **- dedilər: həqiqətən, bu, möcüzə deyil, bəlkə, aşkar olan sehrdir.**

قَالَ مُوسَىٰ أَتَقُولُونَ لِلْحَقِّ لَمَّا جَاءَكُمْ ۖ أَسِحْرٌ هَٰذَا وَلَا يُفْلِحُ السَّاحِرُونَ ﴿٧٧﴾ قَالُوا أَجِئْتَنَا لِتَلْفِتَنَا
عَمَّا وَجَدْنَا عَلَيْهِ آبَاءَنَا وَتَكُونَ لَكُمَا الْكِبْرِيَاءُ فِي الْأَرْضِ وَمَا نَحْنُ لَكُمَا بِمُؤْمِنِينَ ﴿٧٨﴾ وَقَالَ
فِرْعَوْنُ ائْتُونِي بِكُلِّ سَاحِرٍ عَلِيمٍ ﴿٧٩﴾ فَلَمَّا جَاءَ السَّحَرَةُ قَالَ لَهُمْ مُوسَىٰ أَلْقُوا مَا أَنْتُمْ مُلْقُونَ
﴿٨٠﴾ فَلَمَّا أَلْقَوْا قَالَ مُوسَىٰ مَا جِئْتُمْ بِهِ السِّحْرُ ۖ إِنَّ اللَّهَ سَيُبْطِلُهُ ۖ إِنَّ اللَّهَ لَا يُصْلِحُ عَمَلَ الْمُفْسِدِينَ
﴿٨١﴾ وَيُحِقُّ اللَّهُ الْحَقَّ بِكَلِمَاتِهِ وَلَوْ كَرِهَ الْمُجْرِمُونَ ﴿٨٢﴾

---

**77)** (قَالَ مُوسَىٰ أَتَقُولُونَ لِلْحَقِّ لَمَّا جَاءَكُمْ) - **Musa dedi:** (ey camaat)**, nə zaman** (Allah-Təaladan sizə) **haqq** (olan kəlam və möcüzə) **gəlsə,** (ona tənə edib, eyib tutub) **sehr deyirsiniz?** (أَسِحْرٌ هَٰذَا) – **bəs bu** (haqq olan möcüzə) **sehrdirmi?** (وَلَا يُفْلِحُ السَّاحِرُونَ) – (sehr - həqiqəti olmayan xəyaldır)**. Sehrbazların** (yalanı aşkar olub) **nicat tapmazlar.** (Bu möcüzələr Allah-Təala tərəfindən olan həqiqi şeylərdir. Onlara necə sehr demək olar?)

**78)** (قَالُوا أَجِئْتَنَا لِتَلْفِتَنَا عَمَّا وَجَدْنَا عَلَيْهِ آبَاءَنَا) - **dedilər:** (ey Musa)**, bəs gəlibsən ki, bizi ata-babamızı o** (yol) **üzrə tapdığımız dindən qaytarasan?** (İnsanları təqlid məhv edər)**.** (وَتَكُونَ لَكُمَا الْكِبْرِيَاءُ فِي الْأَرْضِ) - **ondan sonra** (Misir) **torpağında böyüklük və səltənət səninlə qardaşın Harunun olsun?** (وَمَا نَحْنُ لَكُمَا بِمُؤْمِنِينَ) – (ya Musa)**, biz heç vaxt** (sizi təsdiq edib) **sizə iman gətirən deyilik.**

**79)** (وَقَالَ فِرْعَوْنُ ائْتُونِي بِكُلِّ سَاحِرٍ عَلِيمٍ) - **firon dedi:** (bunlar sehrbazdırlar)**, bütün alim sehrbazları məndən ötrü toplayıb gətirin,** (ta ki, o sehrbazlar bunlara qalib olub, bunların yalanı aşkar olsun)**.**

**80)** (فَلَمَّا جَاءَ السَّحَرَةُ) – (fironun hökmü ilə) **sehrbazlar gəldiyində,** (Musa ilə üzbəüz durdular)**,** (قَالَ لَهُمْ مُوسَىٰ أَلْقُوا مَا أَنْتُمْ مُلْقُونَ) - **Musa dedi:** (ey sehrbazlar, meydana) **nə atacaqsınız, atın.**

**81)** (فَلَمَّا أَلْقَوْا) - (sehrbazlar öz düzəltdikləri şeylərini) **atanda** (قَالَ مُوسَىٰ مَا جِئْتُمْ بِهِ السِّحْرُ) - **Musa dedi: bu gətirdiyiniz sehrdir,** (nəinki Allah-Təalanın möcüzəsi, hansı ki firon və qövmü ona sehr demişdi)**.** (إِنَّ اللَّهَ سَيُبْطِلُهُ) - **həqiqətən, əlbəttə, Allah-Təala sehri batil edib** (möcüzəni ona qalib edər)**.** (إِنَّ اللَّهَ لَا يُصْلِحُ عَمَلَ الْمُفْسِدِينَ) - **həqiqətən, Allah-Təala** (yer üzündə) **fəsadçı şəxslərin əməllərini islah edib** (onlara qüvvət verməz)**.**

**82)** (وَيُحِقُّ اللَّهُ الْحَقَّ بِكَلِمَاتِهِ) - **Allah-Təala özünün doğru kəlmələri ilə haqqa qüvvət verib sabit edər.** (Musaya vəd etmişdi ki, onu düşmənə qalib etsin) (وَلَوْ كَرِهَ الْمُجْرِمُونَ) - **günahkar asilər xoşlamasa da,** (Allah-Təala onlara baxmayaraq, haqqı batilə qalib edəcəkdir. Allah-Təala Musanı sehrbazlara qalib edib hamısı iman gətirdilər, bunun təfsilatı digər surələrdə bəyan olunubdur)**.**

فَمَا آمَنَ لِمُوسىٰ إِلَّا ذُرِّيَّةٌ مِنْ قَوْمِهِ عَلىٰ خَوْفٍ مِنْ فِرْعَوْنَ وَمَلَإِئِهِمْ أَنْ يَفْتِنَهُمْ ۚ وَإِنَّ فِرْعَوْنَ لَعَالٍ
فِي الْأَرْضِ وَإِنَّهُ لَمِنَ الْمُسْرِفِينَ ﴿٨٣﴾ وَقَالَ مُوسىٰ يَا قَوْمِ إِنْ كُنْتُمْ آمَنْتُمْ بِاللَّهِ فَعَلَيْهِ تَوَكَّلُوا إِنْ
كُنْتُمْ مُسْلِمِينَ ﴿٨٤﴾ فَقَالُوا عَلَى اللهِ تَوَكَّلْنَا ۚ رَبَّنَا لَا تَجْعَلْنَا فِتْنَةً لِلْقَوْمِ الظَّالِمِينَ ﴿٨٥﴾ وَنَجِّنَا
بِرَحْمَتِكَ مِنَ الْقَوْمِ الْكَافِرِينَ ﴿٨٦﴾ وَاَوْحَيْنَآ اِلٰى مُوسٰى وَاَخِيهِ اَنْ تَبَوَّاٰ لِقَوْمِكُمَا بِمِصْرَ بُيُوتًا
وَاجْعَلُوا بُيُوتَكُمْ قِبْلَةً وَاَقِيمُوا الصَّلٰوةَ ۗ وَبَشِّرِ الْمُؤْمِنِينَ ﴿٨٧﴾ وَقَالَ مُوسٰى رَبَّنَآ اِنَّكَ اٰتَيْتَ فِرْعَوْنَ
وَمَلَاَهُ زِينَةً وَاَمْوَالًا فِي الْحَيٰوةِ الدُّنْيَاۙ رَبَّنَا لِيُضِلُّوا عَنْ سَبِيلِكَ ۚ

---

**83)** (فَمَا آمَنَ لِمُوسىٰ إِلَّا ذُرِّيَّةٌ مِنْ قَوْمِهِ) – (fironun qövmündən) **az bir qismi Musaya iman gətirdi,** (عَلىٰ خَوْفٍ مِنْ فِرْعَوْنَ وَمَلَإِئِهِمْ أَنْ يَفْتِنَهُمْ)- **Musaya iman gətirməmələrinin səbəbi firon və böyüklərindən qorxmaları idi ki, birdən iman gətirsələr, onlara əzab edərlər.** (وَإِنَّ فِرْعَوْنَ لَعَالٍ فِي الْأَرْضِ) **- həqiqətən, firon Misirdə olan xalqa qalib və hakim idi.** (وَإِنَّهُ لَمِنَ الْمُسْرِفِينَ)**- həqiqətən, zülm və fəsad etməkdə həddi aşanlardan idi.**

**84)** (وَقَالَ مُوسىٰ يَا قَوْمِ إِنْ كُنْتُمْ آمَنْتُمْ بِاللَّهِ) **- Musa öz qövmü bəni-İsrailə dedi: "Əgər Allah-Təalaya iman gətiribsinizsə,** (firondan qorxmayın). (فَعَلَيْهِ تَوَكَّلُوا) (إِنْ كُنْتُمْ مُسْلِمِينَ) – **əgər özünüzü Allah-Təalaya təslim edib,** (ixlasla ona şərik qoşmayan şəxslərsinizsə)**, Allah-Təalaya təvəkkül edib** (firondan qorxmayın")**.**

**85)** (فَقَالُوا عَلَى اللهِ تَوَكَّلْنَا) **- bəni-İsrail dedi: "Allah-Təalaya təvəkkül etdik."** (رَبَّنَا لَا تَجْعَلْنَا فِتْنَةً لِلْقَوْمِ الظَّالِمِينَ) **- ondan sonra dua edib dedilər: "Ey bizim rəbbimiz, (**firon və onun qövmü olan) **zalım camaatı** (onların əzabını) **bizə düçar etmə."**

**86)** (وَنَجِّنَا بِرَحْمَتِكَ مِنَ الْقَوْمِ الْكَافِرِينَ) **- ey bizim rəbbimiz, bizə bu kafir olan camaatın əlindən nicat ver.** (Fironun rəiyyəti olan qibtilər bəni-İsraili özlərinə qul etmişdilər, onları məşəqqətli əməllərə vadar edirdilər)**.**

**87)** (وَأَوْحَيْنَا إِلىٰ مُوسىٰ وَأَخِيهِ) **- Musa və onun qardaşına** (Haruna) **vəhy edib dedik:** (أَنْ تَبَوَّآ لِقَوْمِكُمَا بِمِصْرَ بُيُوتًا) – **qövmünüzdən** (bəni-İsraildən) **ötrü Misirdə evlər tikin** (ki, namaz və ibadət vaxtında o evlərdə ibadət etsinlər)**.** (وَاجْعَلُوا بُيُوتَكُمْ قِبْلَةً) – **qeyd olunan o evlərinizi** (namaz vaxtı) **özünüzə qiblə edin.** (وَاَقِيمُوا الصَّلٰوةَ) **- namazı qılıb** (tərk etməyin). (وَبَشِّرِ الْمُؤْمِنِينَ) - (ey Musa), **möminlərə müjdə ver** (ki, firondan sizə heç bir zərər yetişməyəcəkdir)**.**

**88)** (وَقَالَ مُوسٰى رَبَّنَآ اِنَّكَ اٰتَيْتَ فِرْعَوْنَ وَمَلَاَهُ زِينَةً وَاَمْوَالًا فِي الْحَيٰوةِ الدُّنْيَا) **- Musa dedi: "Ey bizim rəbbimiz, həqiqətən, sən dünya həyatında firona və onun əyanlarına zinət və hər cür mal veribsən.** (رَبَّنَا لِيُضِلُّوا عَنْ سَبِيلِكَ) **- ey bizim rəbbimiz,** (onlara dünya malı veribsən ki, özləri asi olmaqdan baş-

رَبَّنَا اطْمِسْ عَلٰٓى اَمْوَالِهِمْ وَاشْدُدْ عَلٰى قُلُوبِهِمْ فَلَا يُؤْمِنُوا حَتّٰى يَرَوُا الْعَذَابَ الْاَل۪يمَ ﴿٨٨﴾قَالَ قَدْ
اُج۪يبَتْ دَعْوَتُكُمَا فَاسْتَق۪يمَا وَلَا تَتَّبِعَآنِّ سَب۪يلَ الَّذ۪ينَ لَا يَعْلَمُونَ ﴿٨٩﴾وَجَاوَزْنَا بِبَن۪ٓي اِسْرَٓاء۪يلَ الْبَحْرَ
فَاَتْبَعَهُمْ فِرْعَوْنُ وَجُنُودُهُ بَغْيًا وَعَدْوًاۜ حَتّٰٓى اِذَٓا اَدْرَكَهُ الْغَرَقُۙ قَالَ اٰمَنْتُ اَنَّهُ لَٓا اِلٰهَ اِلَّا الَّذ۪ٓي اٰمَنَتْ
بِه۪ بَنُٓوا اِسْرَٓاء۪يلَ وَاَنَا۬ مِنَ الْمُسْلِم۪ينَ ﴿٩٠﴾ آٰلْـٰٔنَ وَقَدْ عَصَيْتَ قَبْلُ وَكُنْتَ مِنَ الْمُفْسِد۪ينَ ﴿٩١﴾

---

qa digərlərini də) **sənin yolundan kənara salıb,** (asi etsinlər?) (رَبَّنَا اطْمِسْ عَلٰٓى اَمْوَالِهِمْ) **- ey bizim rəbbimiz, bu kafirlərin mallarını məhv et,** (ta ki mallarından bir iz qalmasın)**.** (وَاشْدُدْ عَلٰى قُلُوبِهِمْ) **- və onların qəlblərinə sıxıntı sal** (ki, sıxıntıları daha da artsın)**.** (فَلَا يُؤْمِنُوا حَتّٰى يَرَوُا الْعَذَابَ الْاَل۪يمَ)**- iman gətirməsinlər, ta ki şiddətli əzabı görüb onu dadsınlar."**

**89)** (قَالَ قَدْ اُج۪يبَتْ دَعْوَتُكُمَا) – (Allah-Təala) **buyurdu:** (ey Musa və Harun)**, sizin duanız qəbul olundu,** (فَاسْتَق۪يمَا) – (amma firon və onun camaatını dəvət etməkdə) **möhkəm və bərqərar olun.** (وَلَا تَتَّبِعَآنِّ سَب۪يلَ الَّذ۪ينَ لَا يَعْلَمُونَ) **- əlbəttə, Allah-Təalanın yolunu bilməyən** (cahil) **şəxslərin yoluna tabe olmayın,** (tələsməyin, heç bir işdə tələsmək məsləhət deyil, nə zaman məsləhət olsa, Allah-Təala onlara əzab göndərər. Uca peyğəmbərimiz buyurubdur: "Tələsmək şeytandan, ehtiyatlı olmaq Rəhmandandır" (Tirmizi, Birr, 66))**.**

**90)** (وَجَاوَزْنَا بِبَن۪ٓي اِسْرَٓاء۪يلَ الْبَحْرَ) **- bəni-İsraili dənizdən** (Qırmızı dənizdən) **keçirib** (nicat verdik)**.** (Musa bəni-İsraili götürüb gecə vaxtı Misirdən çıxdı, firon xəbərdar olub onun dalınca düşdü. Bəni-İsrail firon və ordusunun arxadan gəldiyini gördükdə, qorxudan dənizə girdi. Firon da onların dalınca gəlib dənizə girdi, bəni-İsrail nicat tapdı, firon və onun ordusu dənizdə qərq oldu. Necə ki bu ayədə xəbər verir)**.** (فَاَتْبَعَهُمْ فِرْعَوْنُ وَجُنُودُهُ بَغْيًا وَعَدْوًا) **- firon və onun qoşunu zülm və düşmənçilikdən onların** (bəni-İsrailin) **dalınca düşüb,** (dənizin kənarında onlara yetişdi)**.** (حَتّٰٓى اِذَٓا اَدْرَكَهُ الْغَرَقُ)– (bəni-İsrailin dalınca dənizə girdilər)**, elə ki firon qərq olmağa başladı,** (قَالَ اٰمَنْتُ اَنَّهُ لَٓا اِلٰهَ اِلَّا الَّذ۪ٓي اٰمَنَتْ بِه۪ بَنُٓوا اِسْرَٓاء۪يلَ) – (qərq olarkən) **dedi: iman gətirdim, həqiqətən, bəni-İsrailin iman etdiyi Allah-Təaladan başqa, heç bir haqq olan məbud yoxdur,** (وَاَنَا۬ مِنَ الْمُسْلِم۪ينَ) **- mən Allah-Təalaya itaət edib,** (hər bir işi ona həvalə edən şəxslərdənəm)**.**

**91)** (آٰلْـٰٔنَ) **-** (ölüm anında kafir və asilərin tövbələri qəbul olunmadığından batmaqda olan fironun tövbə edib iman gətirməsinə Allah-Təala tərəfindən, sanki, belə cavab verilir: bəs) **indi** (qərq olan vaxtı iman gətirirsən? İndiki iman insana mənfəət verməz)**.** (وَقَدْ عَصَيْتَ قَبْلُ) **- halbuki sən bundan qabaq** (Allah-Təalaya) **asi olub** (tövbəni təxirə salmışdın)**,** (وَكُنْتَ مِنَ الْمُفْسِد۪ينَ) **və bundan qabaq** (dünyada) **fəsad edən şəxslərdən idin.** (Özün zəlalətdə olmaqla birlikdə, xalqı da zəlalətə salırdın. İndi sənin tövbən qəbul deyildir. (Bu ayə

فَالْيَوْمَ نُنَجّيكَ بِبَدَنِكَ لِتَكُونَ لِمَنْ خَلْفَكَ اٰيَةًۜ وَاِنَّ كَثيرًا مِنَ النَّاسِ عَنْ اٰيَاتِنَا لَغَافِلُونَ۟ ﴿٩٢﴾ وَلَقَدْ بَوَّأْنَا بَنٖي اِسْرَٓاءٖيلَ مُبَوَّاَ صِدْقٍ وَرَزَقْنَاهُمْ مِنَ الطَّيِّبَاتِۚ فَمَا اخْتَلَفُوا حَتّٰى جَٓاءَهُمُ الْعِلْمُۜ اِنَّ رَبَّكَ يَقْضٖي بَيْنَهُمْ يَوْمَ الْقِيٰمَةِ فٖيمَا كَانُوا فٖيهِ يَخْتَلِفُونَ ﴿٩٣﴾ فَاِنْ كُنْتَ فٖي شَكٍّ مِمَّٓا اَنْزَلْنَٓا اِلَيْكَ فَسْئَلِ الَّذٖينَ يَقْرَؤُنَ الْكِتَابَ مِنْ قَبْلِكَۚ لَقَدْ جَٓاءَكَ الْحَقُّ مِنْ رَبِّكَ فَلَا تَكُونَنَّ مِنَ الْمُمْتَرٖينَۙ ﴿٩٤﴾ وَلَا تَكُونَنَّ مِنَ الَّذٖينَ كَذَّبُوا بِاٰيَاتِ اللّٰهِ فَتَكُونَ مِنَ الْخَاسِرٖينَ ﴿٩٥﴾

---

buna dəlildir ki, asi və günahkarların tövbəsi ixtiyarları öz əllərində olanda qəbul olunur. Xalq arasında məşhur olan bəzi “mövzu” (uydurma) hədislərdə deyilən -”Allah-Təala günahkarların tövbəsini son nəfəslərində qəbul edər” fikri bu ayə tərəfindən təkzib olunur, Qurani-Şərifə müxalif olan hədislərə etiqad etmək Qurani-Şərifdən üz döndərib kafir olmaqdır)**.**

**92)** (فَالْيَوْمَ نُنَجّيكَ بِبَدَنِكَ) – (ey firon)**, bugünkü gündə** (sən qərq olandan sonra ruhsuz) **bədənini sudan qurtarıb** (kənara çıxardarıq)**.** (لِتَكُونَ لِمَنْ خَلْفَكَ اٰيَةً) **- ta ki səndən sonra gələnlərdən ötrü əlamət və ibrət olasan.** (Baxıb görsünlər ki, mənə asi olub şərik qoşanlara, ya da özünə rəbb deyənlərə necə əzab edirəm?) (وَاِنَّ كَثيرًا مِنَ النَّاسِ عَنْ اٰيَاتِنَا لَغَافِلُونَ) **- həqiqətən, insanlardan bir çoxu bizim ayələrimizdən qafil olublar.**

**93)** (وَلَقَدْ بَوَّأْنَا بَنٖي اِسْرَٓاءٖيلَ مُبَوَّاَ صِدْقٍ) **- firon qərq olub, bəni-İsrail nicat tapandan sonra bəni-İsraili bəyənilən və razı olunan yerdə** (Şam mülkündə) **sakin etdik.** (وَرَزَقْنَاهُمْ مِنَ الطَّيِّبَاتِ) **- onlara pakizə və ləziz olan şeylərdən ruzi verdik.** (فَمَا اخْتَلَفُوا حَتّٰى جَٓاءَهُمُ الْعِلْمُ) **– və** (bəni-İsrail) **onlara elm** (Tövrat) **gələnə qədər** (öz dinlərində) **ixilafa düşmədilər.** (halbuki Tövrat gələndən sonra gərək ittifaq edib dinlərində möhkəm olaydılar, onun əksi oldu)**.** (اِنَّ رَبَّكَ يَقْضٖي بَيْنَهُمْ يَوْمَ الْقِيٰمَةِ فٖيمَا كَانُوا فٖيهِ يَخْتَلِفُونَ) **- həqiqətən,** (ey Məhəmməd)**, sənin rəbbin** (Tövrat gələndən sonra bəni-İsrailin) **ixtilaf etdiyi** (din) **barəsində qiyamət günündə aralarında hökm edər.**

**94)** (فَاِنْ كُنْتَ فٖي شَكٍّ مِمَّٓا اَنْزَلْنَٓا اِلَيْكَ) – (ey Məhəmməd)**, əgər sənə nazil etdiyimiz** (bu Quranın) **bizim tərəfimizdən olmasına şəkk edirsənsə,** (فَسْئَلِ الَّذٖينَ يَقْرَؤُنَ الْكِتَابَ مِنْ قَبْلِكَ) **- səndən qabaq kitab** (Tövrat) **oxuyan şəxslərdən** (yəhudilərdən) **soruş.** (لَقَدْ جَٓاءَكَ الْحَقُّ مِنْ رَبِّكَ) **- həqiqətən, haqq** (olan Quran) **rəbbin Allah-Təaladan sənə gəlib** (onda heç bir şəkk və şübhə yoxdur)**.** (فَلَا تَكُونَنَّ مِنَ الْمُمْتَرٖينَ) – (əlbəttə, Quranın Allah-Təaladan olmasına) **şübhə edənlərdən olma.** (İnancında sabit və bərqərar ol)**.**

**95)** (وَلَا تَكُونَنَّ مِنَ الَّذٖينَ كَذَّبُوا بِاٰيَاتِ اللّٰهِ) **- əlbəttə, Allah-Təalanın ayələrini təkzib edənlərdən olmayıb** (təsdiq etməkdə sabit və möhkəm ol)**.** (فَتَكُونَ مِنَ الْخَاسِرٖينَ) – (təkzib etsən)**, özünə zərər verənlərdən olarsan.** (Hz. peyğəmbər ona nazil olan ayələrə heç vaxt şəkk etməyib, Allah-Təala da ona - sən şəkk

**اِنَّ الَّذِينَ حَقَّتْ عَلَيْهِمْ كَلِمَتُ رَبِّكَ لَا يُؤْمِنُونَ ﴿٩٦﴾ وَلَوْ جَٓاءَتْهُمْ كُلُّ اٰيَةٍ حَتّٰى يَرَوُا الْعَذَابَ**
**الْاَلِيمَ ﴿٩٧﴾ فَلَوْلَا كَانَتْ قَرْيَةٌ اٰمَنَتْ فَنَفَعَهَٓا اِيمَانُهَٓا اِلَّا قَوْمَ يُونُسَ لَمَّٓا اٰمَنُوا كَشَفْنَا عَنْهُمْ عَذَابَ**
**الْخِزْيِ فِي الْحَيٰوةِ الدُّنْيَا**

---

edibsən, demir. Bəlkə, ehtimal şəklində ifadə edir. Yəni şəkk etsən, sənə belə əzab edilər. Burada Hz. Peyğəmbərin Qurana şəkk etməsi ehtimalı göstərilmir. Əksinə, məqsəd yəhudilərin üləmalarını elm ilə vəsf edib, onların Hz. Peyğəmbəri haqq olaraq tanıdıqlarını bəyan etməkdir. Hz. Peyğəmbərə bu şəkildə xitab etməyin faydası da var. O fayda budur ki, Hz. Peyğəmbər bu ayəni yəhudilərə oxuyanda yəhudilər özlərini uca bir mərtəbədə sayıb, Allah-Təala onları şahid göstərəndə Hz. Peyğəmbərlə kin və inad yoluyla danışmazlar. Necə ki belə də oldu, yəhudilərin böyük üləmalarından bəziləri Quranı təsdiq edib iman etdilər)**.**

**96)** (اِنَّ الَّذِينَ حَقَّتْ عَلَيْهِمْ كَلِمَتُ رَبِّكَ لَا يُؤْمِنُونَ) **-** (ey Məhəmməd)**, həqiqətən, sənin rəbbin Allah-Təalanın haqlarında** (küfr içində öləcəkləri şəklində) **hökm verdiyi şəxslər iman gətirməzlər.**

**97)** (وَلَوْ جَٓاءَتْهُمْ كُلُّ اٰيَةٍ) **– onlara hər cür ayə və möcüzə gəlsə də iman gətirməzlər,** (حَتّٰى يَرَوُا الْعَذَابَ الْاَلِيمَ) **- ta ki onlardan ötrü hazır olan şiddətli əzabı görüncəyə qədər.** (Allah-Təala Yunis peyğəmbəri Mosuldakı Neyneva əhlinə göndərdi. Yunis gedib onları Allah-Təalaya dəvət edib ilahi əzabla qorxutdu. Onlar Yunisi təkzib edib ona itaət etmədilər. Yunis onlara üç gündən sonra əzab olacağı vədini verdi. Camaat bir-biri ilə məşvərət etdi: "Biz bu kişidən heç bir yalan görməmişik. Əgər o, bu gecə bizim aramızdan çıxıb getsə, əzab nazil olmasından qorxub tövbə edin." O gecə Yunis onların arasından çıxıb getdi. Yunisi axtarıb tapmadılar. Əzabın gələcəyinə inandılar. Tövbə edib, Allah-Təaladan bağışlanmaq dilədilər. Çölə çıxdılar. Uşaqları analarından, hətta heyvanların balalarını analarından ayırdılar. Ah-nalə edib ağladılar, Allah-Təala da başlarının üstündə səma bəlası olduğu halda, tövbələrini qəbul edib, bəlanı dəf etdi, onlara nicat verdi. Camaatı qoyub onların arasından çıxıb getdiyi üçün Allah-Təala Yunisi (dənizdə) balığın qarnında məhbus etdi. Bu mətləb kitabın 3-cü cildində əs-Saffat surəsində bəyan olunacaqdır. Növbəti ayə də Yunisin qövmünün tövbəsinin qəbul olunduğunu xəbər verir)**.**

**98)** (فَلَوْلَا كَانَتْ قَرْيَةٌ اٰمَنَتْ) **– elə olmayıbdır ki, bir ölkənin əhalisi onlara əzab nazil olan vaxtı iman gətirmiş olsun,** (فَنَفَعَهَٓا اِيمَانُهَٓا اِلَّا قَوْمَ يُونُسَ) **- o iman gətirmələri onlara mənfəət versin, ancaq Yunisun qövmü əzab nazil olan vaxt iman gətirdilər,** (iman onlara mənfəət verib əzab onlardan götürüldü)**.** (لَمَّٓا اٰمَنُوا) **- Yunisin qövmü iman gətirdikdə** (كَشَفْنَا عَنْهُمْ عَذَابَ الْخِزْيِ فِي الْحَيٰوةِ الدُّنْيَا) **– dünya həyatında zəlil edən əzabı Yunisin qövmündən götürdük.** (Yəni

وَمَتَّعْنَاهُمْ اِلٰى حِينٍ ﴿٩٨﴾ وَلَوْ شَآءَ رَبُّكَ لَاٰمَنَ مَنْ فِي الْاَرْضِ كُلُّهُمْ جَمِيعًاۜ اَفَاَنْتَ تُكْرِهُ النَّاسَ
حَتّٰى يَكُونُوا مُؤْمِنِينَ ﴿٩٩﴾وَمَا كَانَ لِنَفْسٍ اَنْ تُؤْمِنَ اِلَّا بِاِذْنِ اللّٰهِۜ وَيَجْعَلُ الرِّجْسَ عَلَى الَّذٖينَ لَا
يَعْقِلُونَ ﴿١٠٠﴾

---

Allah-Təala dünya əzabını onlardan götürdü. Lakin ola bilər ki, başqa bir günah səbəbinə onlara axirətdə əzab etsin)**.** (وَمَتَّعْنَاهُمْ اِلٰى حِينٍ) – (onları əzabdan xilas edib)**, əcəlləri gələnə kimi vaxt verib** (dünya nemətləri ilə ləzzət verdik)**.**

**99)** (وَلَوْ شَآءَ رَبُّكَ لَاٰمَنَ مَنْ فِي الْاَرْضِ كُلُّهُمْ جَمِيعًا) - (ey Məhəmməd)**, əgər sənin rəbbin istəsə, yer üzündə olan** (insanların) **hamısı iman gətirib** (islama daxil olarlar. Amma Allah-Təala onlara ixtiyar verdiyindən heç kimi zorla imana daxil etməz, küfr və iman etmək hər kəsin öz ixtiyarındadır)**.** (اَفَاَنْتَ تُكْرِهُ النَّاسَ حَتّٰى يَكُونُوا مُؤْمِنِينَ) - (ey Məhəmməd)**, bəs belə bir halda, sən xalqı zorla imana vadar edə bilərsən? Ta ki imana daxil olub mömin olsunlar?** (İnsanları zorla imana daxil etmək sizdən ötrü mümkün deyildir. Məxluqata hakim və qalib olan Allah-Təaladır. Əgər Allah-Təala istəsə, özü xalqı zorla imana daxil edər, yoxsa sən edə bilməzsən. Sən onların imanından ötrü çox düşünmə. Onları öz ixtiyarlarına burax. İmana daxil olub olmamaq gərək sərbəst olsun ki, hər kəsə öz əməlinin qarşılığı verilsin, sənə ancaq vəhyi təbliğ etmək lazımdır)**.**

**100)** (وَمَا كَانَ لِنَفْسٍ اَنْ تُؤْمِنَ اِلَّا بِاِذْنِ اللّٰهِ) **- Allah-Təalanın izni** (iman etmələrinə yardımı olmadan) **heç kimin** (öz ixtiyarı ilə) **iman etməsi mümkün deyil.** (İnsan iman etməyə meyil etdikdə Allah-Təala onun üçün imanın bütün yollarını asan edər ki, o şəxs imana daxil olsun)**.** (وَيَجْعَلُ الرِّجْسَ عَلَى الَّذٖينَ لَا يَعْقِلُونَ) – (Allah-Təalanın bəxş etdiyi) **ağıl* üzrə hərəkət etməyən,** (Onu tanıyıb, əmr və qadağalarına agah olmayanları Allah-Təala) **qəzəb və əzabına düçar edər.**

*(*Qeyd: Ağıl Allah-Təalanın insana əmanətidir. İlahi bir lütfdür. Allah-Təala onunla insanı heyvanatdan ayırmışdır. Gərək onunla Allah-Təalanı tanıyıb, onun kamil sifətlərini dərk edib, gücü çatdığı qədər o sifətlərlə bəzənsin və bu səbəbdən Allah-Təalanı bilmədə ağıl kifayət edib peyğəmbərə ehtiyac yoxdur. Peyğəmbərin varlığı şirki qadağan etmək və bir də ilahi ehkamı vəz etməkdən ötrü lazımdır. Heç bir peyğəmbər Allah-Təala tərəfindən gəlib xalqa deməyibdir ki, ey insanlar, deyin ki, Allah-Təala var. Bəlkə, hər bir peyğəmbər belə deyibdir: "Tövhidə inanıb,, Allah-Təalaya şərik qoşmayın." Bu, ağlın təkbaşına Allah-Təalanı tanıya bildiyinə dəlil deyilmi? Burada peyğəmbərə ehtiyac yoxdur, habelə bəzi şeylərdə də ağlın təkbaşına kifayət etməsi açıq-aşkardır. Məsələn, zülm etmək qəbihdir, əfv edib bağışlamaq gözəldir, bu kimi şeylərdə ağıl müstəqildir. Peyğəmbərə ehtiyacı yoxdur. Peyğəmbərlər dəvət zamanı xalqa bu cür mətləbləri izah etsələr də, bu, onları qəflətdən oyadıb xəbərdarlıq etmək üçündür. Allah-Təala ağılla hərəkət etməyənləri məzəmmət edir, hətta əzab vədi də verir) .*

قُلِ انْظُرُوا مَاذَا فِي السَّمٰوَاتِ وَالْاَرْضِۜ وَمَا تُغْنِي الْاٰيَاتُ وَالنُّذُرُ عَنْ قَوْمٍ لَا يُؤْمِنُونَ ﴿١٠١﴾ فَهَلْ
يَنْتَظِرُونَ اِلَّا مِثْلَ اَيَّامِ الَّذِينَ خَلَوْا مِنْ قَبْلِهِمْۜ قُلْ فَانْتَظِرُوٓا اِنّ۪ي مَعَكُمْ مِنَ الْمُنْتَظِر۪ينَ ﴿١٠٢﴾ ثُمَّ
نُنَجّ۪ي رُسُلَنَا وَالَّذ۪ينَ اٰمَنُوا كَذٰلِكَۚ حَقًّا عَلَيْنَا نُنْجِ الْمُؤْمِن۪ينَ ﴿١٠٣﴾ قُلْ يَٓا اَيُّهَا النَّاسُ اِنْ كُنْتُمْ ف۪ي
شَكٍّ مِنْ د۪ين۪ي فَلَٓا اَعْبُدُ الَّذ۪ينَ تَعْبُدُونَ مِنْ دُونِ اللّٰهِ

---

**101)** (قُلِ انْظُرُوا مَاذَا فِي السَّمٰوَاتِ وَالْاَرْضِ) **-** (ey Məhəmməd, səndən möcüzə istəyən o şəxslərə) **de ki,** (ağılla düşünüb, Allah-Təalanın) **səmalarda və yerdə olan** (ibrətamiz, qəribə məxluqatına) **baxın, görün nələr var.** (Onlardan ibrət alıb, onların Xaliqinə sitayiş edin. Daha məndən nə möcüzə istəyirsiniz?) (وَمَا تُغْنِي الْاٰيَاتُ وَالنُّذُرُ عَنْ قَوْمٍ لَا يُؤْمِنُونَ) **-** (ey Məhəmməd)**, iman gətirməyən qövmə** (Allah-Təalanın vəhdətinə işarə edən) **əlamətlər və xəbərdarlıq edən peyğəmbərlər, onlara fayda verən deyildir.** (Bir şəxs ki, ağılla hərəkət etmir, nə peyğəmbərlərin sözləri, nə ayələr və ilahi əlamətlər ona fayda verməz)**.**

**102)** (فَهَلْ يَنْتَظِرُونَ اِلَّا مِثْلَ اَيَّامِ الَّذِينَ خَلَوْا مِنْ قَبْلِهِمْ) **–** (ey Məhəmməd)**, bəlkə, onlar** (müşriklər) **özlərindən qabaq gəlib-keçən ümmətlərin** (Ad, Səmud, onlardan başqa qövmlərə gələn əzablı) **günlərinin mislini gözləyirlər?** (Məkkə müşrikləri də o günlərin mislini istəyib gözləyirlər?) (قُلْ فَانْتَظِرُوٓا اِنّ۪ي مَعَكُمْ مِنَ الْمُنْتَظِر۪ينَ) **-** (ey Məhəmməd, onlara) **de ki, siz o günlərin mislini gözləyin, mən də sizinlə birlikdə gözləyirəm,** (görək o günlərin misli nə vaxt gəlib sizə əzab gələcəkdir? Bədir savaşında gözlədikləri günə - əzaba qovuşub, bəzisi öldürülüb, digərləri də əsir oldu)**.**

**103)** (ثُمَّ نُنَجّ۪ي رُسُلَنَا وَالَّذ۪ينَ اٰمَنُوا) **–** (Məkkə müşriklərinin təkrarını gözlədiyi o günlərdə peyğəmbərləri təkzib edən ümmətləri həlak edib)**, ondan sonra peyğəmbərlərimizə və** (onlarla birlikdə) **iman gətirənlərə nicat verdik,** (ey Məhəmməd, bu müşrikləri də həlak edib, sənə və möminlərə nicat verəcəyəm)**.** (كَذٰلِكَ حَقًّا عَلَيْنَا نُنْجِ الْمُؤْمِن۪ينَ) **- möminlərə bu cür nicat vermək bizə vacib olan bir haqdır,** (əlbəttə, müşrikləri həlak edib, möminlərə nicat verərik)**.**

**104)** (قُلْ يَٓا اَيُّهَا النَّاسُ) **– (ey Məhəmməd), de ki, ey müşriklər,** (اِنْ كُنْتُمْ ف۪ي شَكٍّ مِنْ د۪ين۪ي) **- əgər mənim dinim** (və onun düzgünlüyü) **barəsində şübhəniz varsa,** (insaf və ağılla qulaq asıb, görün ki, mənim dinim şəkk olunmalı din deyildir)**.** (فَلَٓا اَعْبُدُ الَّذ۪ينَ تَعْبُدُونَ مِنْ دُونِ اللّٰهِ) **–** (sizinlə mənim fərqim bundadır ki)**, mən sizin ibadət etdiklərinizə** (Allah-Təaladan* başqasına) **ibadət etmərəm.**

*(*Qeyd: Əgər Hz. Peyğəmbər bu zəmanədə olsaydı, hər halda müşriklərə xitab etdiyi bu ayə ilə bizə xitab edərdi. Biz adımızı müsəlman qoymuşuq, amma hər bir şəhərdə, kənddə, hətta biyabanlarda elə bir məkan yoxdur ki, o yerlərdə olan müsəlmanlar özlərindən ötrü bir ziyarətgah yeri düzəltməsinlər. Bəzilərində məqbərə də var. Bəzən məqbərəsiz yerdə olan daşa, ya da özlərinin uydurduğu əl və ya ayaq*

وَلٰكِنْ اَعْبُدُ اللّٰهَ الَّذي يَتَوَفّٰيكُمْ ۚ وَاُمِرْتُ اَنْ اَكُونَ مِنَ الْمُؤْمِنِينَ ۙ ﴿١٠٤﴾ وَاَنْ اَقِمْ وَجْهَكَ لِلدّٖينِ حَنِيفًا ۚ وَلَا تَكُونَنَّ مِنَ الْمُشْرِكِينَ ﴿١٠٥﴾ وَلَا تَدْعُ مِنْ دُونِ اللّٰهِ مَا لَا يَنْفَعُكَ وَلَا يَضُرُّكَ ۚ فَاِنْ فَعَلْتَ فَاِنَّكَ اِذًا مِنَ الظَّالِمِينَ ﴿١٠٦﴾ وَاِنْ يَمْسَسْكَ اللّٰهُ بِضُرٍّ فَلَا كَاشِفَ لَهُ اِلَّا هُوَ ۚ وَاِنْ يُرِدْكَ بِخَيْرٍ فَلَا رَآدَّ لِفَضْلِهٖ يُصِيبُ بِهٖ مَنْ يَشَآءُ مِنْ عِبَادِهٖ وَهُوَ الْغَفُورُ الرَّحِيمُ ﴿١٠٧﴾

---

*yerinə üzlərini sürtüb dua-niyaz edər, yardım diləyərlər. Bəs bundan artıq bütpərəstlik olarmı? Əgər bu zəmanəyə cəhalət zəmanəsi adı qoyulsa, layiqdir. Hamısından betər də odur ki, özlərini müsəlmanların rəhbəri sayanlar məhz avamları aldatmaqdan ötrü onların qabağına düşüb, onları qoyun dəstəsi kimi o bütpərəstlik məqamına çəkib, orada öz cibgirlik sənətlərini son dərəcə məharət və ustalıqla işlədib, xalqı Allah-Təalanın rəhmətinə ümidvar edib, behiştin açarını onların əlinə verib, şad-xürrəm öz mənzillərinə qaytarırlar. Belə bir halda islam aləmindən nə gözləmək olar? Hamısı cəhalət xəstəliyinə düçar olub).*

(وَلٰكِنْ اَعْبُدُ اللّٰهَ الَّذي يَتَوَفّٰيكُمْ) - **lakin mən o Allah-Təalaya ibadət edirəm ki, sizi vəfat etdirib öldürər,** (bəs belə bir dinə şəkk edirsiniz? Sizi öldürəcək olan Allah-Təalaya ibadət etmək lazımdır, nəinki zərər və mənfəət verməyən cansız şeylərə)**.** (وَاُمِرْتُ اَنْ اَكُونَ مِنَ الْمُؤْمِنِينَ) **- Allah-Təala mənə əmr edib ki, gə-rək möminlərdən olam,** (bunu iki şeylə, bir - mənə verdiyi ağılla, o birisi də Qurani-Şəriflə əmr edibdir)**.**

**105)** (وَاَنْ اَقِمْ وَجْهَكَ لِلدّٖينِ حَنِيفًا) – (Allah-Təala mənə buyurubdur ki,) **üzünü islama çevirib düz saxla,** (bir halda ki, başqa dinlərdən üz döndərib, düz is-lam üzrə olasan)**.** (وَلَا تَكُونَنَّ مِنَ الْمُشْرِكِينَ) **- əlbəttə, müşriklərdən olma.**

**106)** (وَلَا تَدْعُ مِنْ دُونِ اللّٰهِ مَا لَا يَنْفَعُكَ وَلَا يَضُرُّكَ) – (yenə Allah-Təala mənə əmr buyurubdur ki,) **Allah-Təaladan başqa, sənə nə mənfəət, nə də zərər verən şeylərə** (bütlərə) **dua və ibadət etmə.** (فَاِنْ فَعَلْتَ فَاِنَّكَ اِذًا مِنَ الظَّالِمِينَ) **- əgər belə etsən, o vaxt həqiqətən, zalımlardan olarsan.** (Çünki Allah-Təalaya şərik qoşmaq böyük zülmdür)**.**

**107)** (وَاِنْ يَمْسَسْكَ اللّٰهُ بِضُرٍّ) **-** (ey Məhəmməd)**, əgər Allah-Təala sənə bir bəla və müsibət yetirsə,** (onu Allah-Təaladan başqa, səndən dəf edən kim-dir?) (فَلَا كَاشِفَ لَهُ اِلَّا هُوَ) **- o** (bəlanı) **Allah-Təaladan başqa** (səndən) **götürən olmaz,** (وَاِنْ يُرِدْكَ بِخَيْرٍ) **- əgər Allah-Təala sənə bir xeyir və mənfəət yetirmək istəsə,** (فَلَا رَآدَّ لِفَضْلِهٖ) **- Allah-Təalanın xeyir və lütfünü** (səndən) **geri qay-tarmağa heç kim qadir olmaz.** (يُصِيبُ بِهٖ مَنْ يَشَآءُ مِنْ عِبَادِهٖ) **- Allah-Təala öz bəndələrindən istədiyinə** (məsləhət olsa) **xeyir yetirər.** (وَهُوَ الْغَفُورُ الرَّحِيمُ) – **Allah-Təala** (bəndələri tövbə edərsə, etdikləri xəta və müsibəti bağışlayıb) **rəhm edəndir.**

قُلْ يَٓا اَيُّهَا النَّاسُ قَدْ جَٓاءَكُمُ الْحَقُّ مِنْ رَبِّكُمْۚ فَمَنِ اهْتَدٰى فَاِنَّمَا يَهْتَدِي لِنَفْسِهۚ وَمَنْ ضَلَّ فَاِنَّمَا
يَضِلُّ عَلَيْهَاۚ وَمَٓا اَنَا۬ عَلَيْكُمْ بِوَكِيلٍ ﴿١٠٨﴾ وَاتَّبِعْ مَا يُوحٰٓى اِلَيْكَ وَاصْبِرْ حَتّٰى يَحْكُمَ اللّٰهُۚ وَهُوَ خَيْرُ
الْحَاكِمِينَ ﴿١٠٩﴾

---

**108)** (قُلْ يَٓا اَيُّهَا النَّاسُ) **-** (ey Məhəmməd)**, de ki, ey insanlar,** (قَدْ جَٓاءَكُمُ الْحَقُّ مِنْ رَبِّكُمْ) **- həqiqətən, haqq** (olan Quran və islam dini) **rəbbiniz Allah-Təala tərəfindən sizə gəldi.** (فَمَنِ اهْتَدٰى فَاِنَّمَا يَهْتَدِي لِنَفْسِه) **- kim ki hidayət tapıb** (Qurana və islama tabe olsa)**, həqiqətən, o şəxs öz xeyrinə hidayət tapar,** (وَمَنْ ضَلَّ فَاِنَّمَا يَضِلُّ عَلَيْهَا) **- kim ki zəlalətə düşüb** (Quran və islamdan kənar olsa)**, həqiqətən,** (o zəlalətə düşməyi) **öz zərərinədir.** (وَمَٓا اَنَا۬ عَلَيْكُمْ بِوَكِيلٍ)**- mən sizin işlərinizə vəkil deyiləm** (ki, əməllərinizi qoruyum. Mən ancaq Allah-Təalanın rəhmətilə müjdələyib, əzabından qorxudanam. Amma əməllərinizin hesabı Allah-Təalayadır)**.**

**109)** (وَاتَّبِعْ مَا يُوحٰٓى اِلَيْكَ) **-** (ey Məhəmməd)**, Allah-Təaladan sənə vəhy olunana tabe olub** (xalqın sözlərinə qulaq asma)**.** (وَاصْبِرْ حَتّٰى يَحْكُمَ اللّٰهُ) **– Allah-Təala hökm** (müşriklərə qarşı sənə yardım və qələbə hökmü) **verib,** (onlara qalib olana qədər xalqın əziyyətinə və səndən üz döndərib, sənin dininə daxil olmamalarına) **səbir edib işini Allah-Təalaya həvalə et.** (وَهُوَ خَيْرُ الْحَاكِمِينَ) **- hökm edənlərin ən yaxşısı Allah-Təaladır.** (Elə ki, bu ayə nazil oldu, Hz. Peyğəmbər Mədinə əhlini - ənsarı toplayıb buyurdu: "Ey ənsar camaatı, məndən sonra bəla və möhnətə düçar olacaqsınız, mənimlə (axirətdə) görüşənə qədər səbir edin." (Tirmizi, Fitən 25) Yəni Allah-Təala mənə bu ayədə səbir etməyi əmr etdi. Mən səbir etdim, siz də məndən sonra səbir edin. Ənəs ibn Malik deyir: "Biz ənsar Hz. Peyğəmbərin sözlərinə baxıb səbir etmədik. Müaviyə ibn Əbu Süfyan Mədinəyə gələndə bütün Mədinə əhli ənsar onu qarşılamağa çıxdı. Əbu Qətadə Ənsari çıxmadı, Müaviyə evə gedib dincələndən sonra Əbu Qətadə onun yanına getdi. Müaviyə dedi: "Niyə məni qarşılamaq üçün Mədinədən çıxmadın?" Əbu Qətadə dedi: "Minməyə heyvanımız yox idi." Müaviyə dedi: "Hanı sizin su daşıyan dəvələriniz? (Bu sözü istehzadan ötrü dedi)." Əbu Qətadə cavab verib dedi: "O dəvələr Bədir savaşında səni və atan Əbu Süfyanı axtarmaqdan həlak oldular. Hz. peyğəmbər dedi: "Məndən sonra bəlaya düşəcəksiniz." Müaviyə dedi: "Ondan sonra nə buyurdu?" Əbu Qətadə dedi: "Buyurdu ki, mənimlə görüşənə qədər səbir edin." Müaviyə dedi: "Elə isə səbir edin." Dedi, "Əlbəttə, səbir edirik." (Tirmizi, Fitən 25)

Yunis surəsinin təfsiri bitdi. Hz. peyğəmbər buyurubdur: "Yunis surəsini kim oxusa, Allah-Təala ona 10 mükafat verər" (Zəmaxşəri, Kəşşaf, II/258)**.**



# HUD SURƏSİ



11-ci surədir. Məkkədə nazil olub, 123 ayə, 1600 kəlmə, 9567 hərfdir.

بِسْمِ اللّٰهِ الرَّحْمٰنِ الرَّحِيمِ. الٓرٰ كِتَابٌ اُحْكِمَتْ اٰيَاتُهُ ثُمَّ فُصِّلَتْ مِنْ لَدُنْ حَكِيمٍ خَبِيرٍۙ ﴿١﴾ اَلَّا تَعْبُدُوٓا اِلَّا اللّٰهَۜ اِنَّنِي لَكُمْ مِنْهُ نَذِيرٌ وَبَشِيرٌۙ ﴿٢﴾ وَاَنِ اسْتَغْفِرُوا رَبَّكُمْ ثُمَّ تُوبُوٓا اِلَيْهِ يُمَتِّعْكُمْ مَتَاعًا حَسَنًا اِلٰٓى اَجَلٍ مُسَمًّى وَيُؤْتِ كُلَّ ذِي فَضْلٍ فَضْلَهُۜ

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1)** (الٓرٰ) **- Bu surənin adı Əlif ləm ra-dır.** (كِتَابٌ اُحْكِمَتْ اٰيَاتُهُ) **- bu Quran ayələri son dərəcə möhkəmləndirilmiş,** (heç bir xələl və nöqsanın ona yol tapa bilmədiyi) **bir kitabdır** (necə ki uca bir imarətin binası son dərəcə möhkəm olanda ona heç bir xələl gəlməz, Qurani-Kərimin açıq-aşkar olan ayələri də belədir, uca ərşdən nazil olub, Hz. Məhəmməddən zühur edən Qurani-Kərimin ayələri hənif islam dininin əsasıdır. Düşmən və bədxahların xəyanət əli ona çatmaz. Qurani-Şərifi nazil edib, onu hər bir nöqsan və eyibdən mühafizə edən Allah-Təaladır). (ثُمَّ فُصِّلَتْ) **-** (ləl-cəvahiratın qisimləri bir-birilərinə qarışmadığı kimi, habelə Qurani-Şərifin ayələri möhkəm olandan) **sonra da** (tövhid və ehkamı, vəz və qissələri ehtiva edən ayələrin hamısı) **təfsilatı ilə zikr olunub,** (bir-birilərinə qarışmayıb, işıqlı ulduzlar kimi cəhalət zülmətində qalanlara hidayət göstərməkdə möhkəm bir dəlil və sübutdur). (مِنْ لَدُنْ حَكِيمٍ خَبِيرٍ) – (Qurani-Şərifin ayələri möhkəm və təfsilatlı olub)**, hikmət və elm sahibi, hər bir şeydən xəbərdar olan Allah-Təala tərəfindən** (nazil olubdur)**.**

**2)** (اَلَّا تَعْبُدُوٓا اِلَّا اللّٰهَ) **-** (ey Məhəmməd, xalqa de ki, sizə bu cür möhkəm və təfsilatlı ayələrlə Quran göndərən, haqq və yeganə olan) **Allah-Təaladan başqasına ibadət etməyin.** (اِنَّنِي لَكُمْ مِنْهُ نَذِيرٌ وَبَشِيرٌ) **- həqiqətən, mən sizi Allah-Təala tərəfindən əzabla qorxudan və savabla müjdələyən bir** (peyğəmbərəm)**.**

**3)** (وَاَنِ اسْتَغْفِرُوا رَبَّكُمْ) – (şərik qoşub, asi olduğunuz üçün) **Allah-Təaladan bağışlanmağızı diləyin** (və Ona yönəlin). (ثُمَّ تُوبُوٓا اِلَيْهِ) **- ondan sonra tövbə edib,** (bunda sabit olub Allah-Təalaya itaət və ibadət edin). (يُمَتِّعْكُمْ مَتَاعًا حَسَنًا اِلٰٓى اَجَلٍ مُسَمًّى) – (siz tövbə edəndən sonra Allah-Təala da) **müəyyən bir vaxta kimi** (vəfat vaxtınadək) **sizə dünyada gözəl nemətlər bəxş edər.** (وَيُؤْتِ كُلَّ ذِي فَضْلٍ فَضْلَهُ) – (axirətdə də) **hər bir şəxsə əməlindən artıq mükafat verər.** (İnsan nə qədər çox yaxşı və gözəl əməllər meydana gətirsə, Allah-Təala da onun mü-

وَاِنْ تَوَلَّوْا فَاِنّ۪يٓ اَخَافُ عَلَيْكُمْ عَذَابَ يَوْمٍ كَب۪يرٍ ﴿٣﴾ اِلَى اللّٰهِ مَرْجِعُكُمْۚ وَهُوَ عَلٰى كُلِّ شَيْءٍ قَد۪يرٌ
﴿٤﴾ اَلَٓا اِنَّهُمْ يَثْنُونَ صُدُورَهُمْ لِيَسْتَخْفُوا مِنْهُۜ اَلَا ح۪ينَ يَسْتَغْشُونَ ثِيَابَهُمْۙ يَعْلَمُ مَا يُسِرُّونَ وَمَا
يُعْلِنُونَۚ اِنَّهُ عَل۪يمٌ بِذَاتِ الصُّدُورِ ﴿٥﴾ وَمَا مِنْ دَٓابَّةٍ فِي الْاَرْضِ اِلَّا عَلَى اللّٰهِ رِزْقُهَا وَيَعْلَمُ مُسْتَقَرَّهَا
وَمُسْتَوْدَعَهَاۜ كُلٌّ ف۪ي كِتَابٍ مُب۪ينٍ ﴿٦﴾ وَهُوَ الَّذ۪ي خَلَقَ السَّمٰوَاتِ وَالْاَرْضَ ف۪ي سِتَّةِ اَيَّامٍ

---

kafatını verib, heç bir şeyi ondan əskik etməz). (وَاِنْ تَوَلَّوْا) - **əgər** (mənim öyüd-nəsihətimə qulaq asmayıb, məndən, dediyim sözlərdən) **üz döndərsəniz,** (فَاِنّ۪يٓ اَخَافُ عَلَيْكُمْ عَذَابَ يَوْمٍ كَب۪يرٍ) - **həqiqətən, mən qorxuram ki, sizə böyük olan günün** (qiyamət gününün) **əzabı yetişib həlak olasınız.**

**4)** (اِلَى اللّٰهِ مَرْجِعُكُمْ) - (qiyamət günündə) **hamınızın qayıdacağı yer Allah-Təala tərəfinədir.** (وَهُوَ عَلٰى كُلِّ شَيْءٍ قَد۪يرٌ) - **Allah-Təala hər bir şeyə** (və asilərə şiddətli əzab etməyə) **qadirdir,** (heç bir şey onu əzabdan aciz etməz)**.**

**5)** (اَلَٓا اِنَّهُمْ يَثْنُونَ صُدُورَهُمْ) - (ey Məhəmməd)**, xəbərdar ol, həqiqətən, bu müşrik və kafirlər sinələrində olanı** (qəlblərini haqdan batil tərəfinə) **döndərirlər.** (لِيَسْتَخْفُوا مِنْهُ) **- ta ki** (qəlbən haqdan döndüklərini) **Allah-Təaladan gizlətsinlər.** (اَلَا ح۪ينَ يَسْتَغْشُونَ ثِيَابَهُمْ) - (ey Məhəmməd)**, xəbərdar ol, müşriklər** (Allah-Təala kəlamını eşitməmək və haqdan üz döndərdiklərini gizlətmək üçün) **libaslarını başlarına salarlar,** (Hz. Peyğəmbər Quran oxuyanda müşriklər başlarına örtü salardılar ki, peyğəmbərin sözlərini eşitməsinlər)**,** (يَعْلَمُ مَا يُسِرُّونَ وَمَا يُعْلِنُونَ) – (Allah-Təala üçün qəlblərindəkini gizlədib və ya aşkar etməyin bir fərqi yoxdur)**, Allah-Təala gizlətdikləri və aşkar etdikləri hər bir şeydən agahdır.** (اِنَّهُ عَل۪يمٌ بِذَاتِ الصُّدُورِ) **- həqiqətən, Allah-Təala sinələrdə olan** (hər bir sirrdən) **agahdır.**

**6)** (وَمَا مِنْ دَٓابَّةٍ فِي الْاَرْضِ اِلَّا عَلَى اللّٰهِ رِزْقُهَا) **- yer üzündə hərəkət edən heç bir həyat sahibi yoxdur ki, onların ruzisi Allah-Təaladan olmasın.** (Hər bir şəxsin özünün halına uyğun ona ruzi verər. Hər bir şəxsdən ötrü müəyyən bir ruzi təyin edibdir)**.** (وَيَعْلَمُ مُسْتَقَرَّهَا وَمُسْتَوْدَعَهَا) – (yer üzündə hərəkət edən hər bir həyat sahibinin anadan olmadan əvvəl ata belində və ana rəhmində) **yerləşdiyi yerdən və** (öləndən sonra torpaqda) **əmanət qoyulan yerlərinə Allah-Təala agahdır.** (كُلٌّ ف۪ي كِتَابٍ مُب۪ينٍ) – (yer üzündə bütün hərəkət edənlərin mövcud olmasından qabaq və sonra olan) **hər bir şey Allah-Təalanın elmində** (qeyd olunub və dəyişən deyildir)**.**

**7)** (وَهُوَ الَّذ۪ي خَلَقَ السَّمٰوَاتِ وَالْاَرْضَ ف۪ي سِتَّةِ اَيَّامٍ) **- Allah-Təala** (öz açıq-aşkar qüdrəti ilə) **səmaları və yeri altı gündə** (6 gün qədər olan bir zamanda) **yaratdı.** (Gecə və gündüz, yəni zaman səmaların və yerdən sonra yaradıldığından - ayədəki 6 gündən məqsəd 6 gün qədər olan bir zamandır. Hər bir əməldə tələsmək qınanan, ehtiyat və aramla iş görmək isə bəyənilən bir şeydir, çünki

وَكَانَ عَرْشُهُ عَلَى الْمَآءِ لِيَبْلُوَكُمْ اَيُّكُمْ اَحْسَنُ عَمَلًاۜ وَلَئِنْ قُلْتَ اِنَّكُمْ مَبْعُوثُونَ مِنْ بَعْدِ الْمَوْتِ لَيَقُولَنَّ الَّذِينَ كَفَرُوٓا اِنْ هٰذَآ اِلَّا سِحْرٌ مُبِينٌ ﴿٧﴾ وَلَئِنْ اَخَّرْنَا عَنْهُمُ الْعَذَابَ اِلٰٓى اُمَّةٍ مَعْدُودَةٍ لَيَقُولُنَّ مَا يَحْبِسُهُۜ اَلَا يَوْمَ يَأْتِيهِمْ لَيْسَ مَصْرُوفًا عَنْهُمْ وَحَاقَ بِهِمْ مَا كَانُوا بِهٖ يَسْتَهْزِؤُنَ ﴿٨﴾ وَلَئِنْ اَذَقْنَا الْاِنْسَانَ مِنَّا رَحْمَةً ثُمَّ نَزَعْنَاهَا مِنْهُۚ اِنَّهُ لَيَؤُسٌ كَفُورٌ ﴿٩﴾

---

fikir və ehtiyat ilə əməl etmək xətadan qoruyar. Allah-Təala bəndələrinə bunu başa salmaq üçün səmaları və yeri 6 gündə yaratdığını buyurur). (وَكَانَ عَرْشُهُ عَلَى الْمَآءِ) – (səmaların və yerin yaradılmasından qabaq) **Allah-Təalanın ərşi su üzərində** (və sudan yuxarıda) **idi.** (Yəni səmaların və yerin yaradılmasından qabaq Allah-Təalanın ərşi, bir də su yaradılıbdır. Ərş -taxt mənasındadır. Allah-Təalanın ərşi onun bütün məxluqat üzərindəki qüdrət və hakimiyyətinə işarədir. Yer üzündə olan bütün ruh sahiblərinin varlığının böyük hissəsi su olduğundan həyat su deməkdir, necə ki Allah-Təala Qurani-Şərifdə - bütün şeylərin həyatı sudandır, buyurub, ayənin mənası da buna görədir. Doğrusunu Allah bilir. (Allah-Təalanın bütün varlıqlar üzərindəki qüdrət və hakimiyyəti onlar hələ yaradılmamışdan, əzəldən bəri sabit və bərqərardır. Onları yaradıb, sonra məhv edib, yenidən yaratması üçün yeni bir qüdrətə ehtiyacı yoxdur. Həmin əzəli qüdrəti ilə davamlı olaraq öldürüb diriltmək Onun zatına xas olub, bütün mükəmməl sifətlər, o cümlədən qüdrət sifəti Onun zatında toplanmışdır. Onun şanı və hakimiyyəti nə ucadır!) (لِيَبْلُوَكُمْ اَيُّكُمْ اَحْسَنُ عَمَلًا) – (Allah-Təala səmaları, yeri yaradıb, siz bəndələrini yerdə sakin edib, hər bir neməti sizə bəxş edib, itaət və ibadət etməyi, günahdan çəkinməyi sizə təklif etdi ki,) **sizi sınasın,** (görsün)**, hansı biriniz yaxşı və gözəl əməl sahibi olursunuz?** (وَلَئِنْ قُلْتَ اِنَّكُمْ مَبْعُوثُونَ مِنْ بَعْدِ الْمَوْتِ) - (ey Məhəmməd)**, əgər müşriklərə desən ki, həqiqətən, öləndən sonra diriləcəksiniz,** (لَيَقُولَنَّ الَّذِينَ كَفَرُوٓا) **- əlbəttə, kafir olan şəxslər** (müşriklər) **deyərlər:** (اِنْ هٰذَآ اِلَّا سِحْرٌ مُبِينٌ) **- bu söz açıq-aşkar sehrdən** (batil sözdən) **başqa bir şey deyil.**

**8)** (وَلَئِنْ اَخَّرْنَا عَنْهُمُ الْعَذَابَ اِلٰى اُمَّةٍ مَعْدُودَةٍ) **- əgər müşriklərin əzabını bir neçə müddətə** (Bədir savaşınadək) **təxirə salsaq,** (لَيَقُولُنَّ مَا يَحْبِسُهُ) – (əlbəttə, müşriklər) **deyərlər: o əzabı bizdən nə saxlayıb,** (mane olur? Niyə o əzab bizə gəlimir? Bu sözü istehza üçün deyirdilər). (اَلَا يَوْمَ يَأْتِيهِمْ لَيْسَ مَصْرُوفًا عَنْهُمْ) - (ey Məhəmməd)**, xəbərdar ol, o gün ki** (Bədir günü) **onlara əzab gələr, o gün də əzab onlardan qaytarılan deyil,** (əlbəttə, əzab onları yaxalayacaqdır). (وَحَاقَ بِهِمْ مَا كَانُوا بِهٖ يَسْتَهْزِؤُنَ) **- və istehza edib tələsdikləri o əzab onları əhatə edib** (əzabdan xilas olmayacaqlar)**.**

**9)** (وَلَئِنْ اَذَقْنَا الْاِنْسَانَ مِنَّا رَحْمَةً) - (ey Məhəmməd)**, əgər insana öz tərəfimizdən bir nemət** (səhhət və dünya malı) **dadızdırsaq,** (ثُمَّ نَزَعْنَاهَا مِنْهُ) – (o neməti verəndən) **sonra da onu geri alsaq,** (اِنَّهُ لَيَؤُسٌ كَفُورٌ) **- həqiqətən, insan belə**

وَلَئِنْ اَذَقْنَاهُ نَعْمَآءَ بَعْدَ ضَرَّآءَ مَسَّتْهُ لَيَقُولَنَّ ذَهَبَ السَّيِّاٰتُ عَنِّيۜ اِنَّهُ لَفَرِحٌ فَخُورٌۙ ﴿١٠﴾ اِلَّا الَّذِينَ
صَبَرُوا وَعَمِلُوا الصَّالِحَاتِۜ اُولٰٓئِكَ لَهُمْ مَغْفِرَةٌ وَاَجْرٌ كَبِيرٌ ﴿١١﴾ فَلَعَلَّكَ تَارِكٌ بَعْضَ مَا يُوحٰىٓ
اِلَيْكَ وَضَٓائِقٌ بِهٖ صَدْرُكَ اَنْ يَقُولُوا لَوْلَٓا اُنْزِلَ عَلَيْهِ كَنْزٌ اَوْ جَٓاءَ مَعَهُ مَلَكٌۜ اِنَّمَٓا اَنْتَ نَذِيرٌۜ وَاللّٰهُ عَلٰى
كُلِّ شَيْءٍ وَكِيلٌۜ ﴿١٢﴾

---

**halda məyus olar,** (əvvəlki nemətlərə də) **nankorluq edib,** (onlardan ötrü Allah-Təalaya şükür etməz)**.**

**10)** (وَلَئِنْ اَذَقْنَاهُ نَعْمَآءَ بَعْدَ ضَرَّآءَ مَسَّتْهُ) **- əgər insana yetişən zərərlərdən sonra ona çoxlu nemətlər** (dadızdırıb ruzi) **versək,** (لَيَقُولَنَّ ذَهَبَ السَّيِّاٰتُ عَنِّي) **- əlbəttə, insan deyər ki, məni qəmgin edən zərərlər məndən getdi.** (İndi nemət və şadlıq zamanıdır. Bu şeyləri Allah-Təalaya isnad etmədiyindən Allah-Təala belə buyurur:) (اِنَّهُ لَفَرِحٌ فَخُورٌ) **- həqiqətən, insan** (zərərin gedib nemətin gəlməsi səbəbilə) **şad olub** (xalqa qarşı) **təkəbbürlənəndir.** (Şad olub təkəbbürlənmək insanın Allah-Təalaya şükür etməsinə mane olar)**.**

**11)** (اِلَّا الَّذِينَ صَبَرُوا وَعَمِلُوا الصَّالِحَاتِ) – (dünya neməti insanın əlindən çıxanda məyus olar, elə ki ona nemət üz verdi, məğrur olub xalqa qarşı təkəbbürlənib, Allah-Təalaya şükür etməyi tərk edər. İnsanlar belədir)**, ancaq o şəxslər ki,** (nemət və zərər məqamında) **səbir edib yaxşı əməllər edər,** (اُولٰٓئِكَ لَهُمْ مَغْفِرَةٌ وَاَجْرٌ كَبِيرٌ) **- onlardan ötrü Allah-Təala yanında günahların bağışlanması və böyük əcr vardır.**

**12)** (فَلَعَلَّكَ تَارِكٌ بَعْضَ مَا يُوحٰىٓ اِلَيْكَ) - (ey Məhəmməd)**,** (müşriklərə yetirmək üçün Allah-Təaladan) **sənə vəhy olunan** (o hökmlərin bəzisini) **tərk etmək istəyirsən,** (وَضَٓائِقٌ بِهٖ صَدْرُكَ) – (o hökmləri onlara oxumaqda) **köksün sıxılıb,** (onların xahişini etməkdən ötrü o hökmləri onlara oxumaq istəmirsən. Müşriklər Hz. Peyğəmbərdən bəzi möcüzələr istəyirdilər, məsələn, deyirdilər: "Allah sənə bir xəzinə versin, ya da səninlə bir mələk gəlib sənin doğru olmağına şəhadət etsin." Qurana qulaq asmayıb, istehza edirdilər. Hz. Peyğəmbər də qəbul etməyəcəklər deyə bəzi ehkamı onlara yetirməkdən qorxurdu, ürəyi sıxılırdı. O səbəbdən Allah-Təala Hz. Peyğəmbəri təşviq edib buyurur: "Onlara etina etməyib ilahi hökmü çatdır")**.** (اَنْ يَقُولُوا لَوْلَٓا اُنْزِلَ عَلَيْهِ كَنْزٌ) - (ey Məhəmməd, bəzi hökmləri onlara yetirməkdən sıxılırsan, qorxursan ki, birdən belə) **deyərlər: "Niyə ona bir xəzinə nazil olmur?** (اَوْ جَٓاءَ مَعَهُ مَلَكٌ) – **ya da onunla bir mələk gəlib, onun doğru olduğuna şəhadət etmir?"** (Bu qorxudan bəzi hökmləri xalqa yetirmək istəmirsən)**.** (اِنَّمَٓا اَنْتَ نَذِيرٌ) **-** (ey Məhəmməd, bu şeyləri ki, səndən istəyirlər, heç biri olan deyil)**, həqiqətən, sən ancaq xalqı Allah-Təalanın əzabı ilə qorxudansan.** (Onların xahiş etdiyi möcüzələri göstərmək istəsən də, bu, sənin ixtiyarında deyil)**,** (وَاللّٰهُ عَلٰى كُلِّ شَيْءٍ وَكِيلٌ) **- Allah-Təala**

اَمْ يَقُولُونَ افْتَرٰيهُ ۜ قُلْ فَأْتُوا بِعَشْرِ سُوَرٍ مِثْلِهٖ مُفْتَرَيَاتٍ وَادْعُوا مَنِ اسْتَطَعْتُمْ مِنْ دُونِ اللّٰهِ اِنْ كُنْتُمْ صَادِقٖينَ ﴿١٣﴾

---

**hər bir şeyə vəkildir,** (müşrik və asilərin dediklərini qeyd edib, onlara cəza verəndir. Ey Məhəmməd), sənə vəhy olunan hökmləri açıq ürəklə xalqa* çatdır. Onların təkəbbür və qürurlarına baxmayıb, istehzalarına etina etmə)**.**

*(*Qeyd: Peyğəmbərdən sonra özlərini peyğəmbərin vəkili, islamın himayədarı sayıb, müsəlmanlara rəhbərlik iddiasında olanlar gərək bu ayədən ibrət alıb, ilahi ehkamı xalqa çatdırmada tərəfgirlik etməyib, Qurani-Şərifin hər bir hökmünü olduğu kimi, doğru şəkildə çatdırsınlar. Allah-Təalanın hökmünə məzəmmət, ya da istehza edənin sözünə qulaq asmayıb, gərək, yandıran od kimi olsunlar. Nəinki az bir dünya malından ötrü Allah-Təalanın Qurani-Şərifdə zikr olunan hökmlərini pərdə arxasında gizlədib, avam camaatın arzusuna görə, onun əksini çatdırıb, ilahi əzaba bais olsunlar. Dini rəhbərlərin Qurani-Şərifin hökmlərini öz arzularına uyğun şəkildə xalqa çatdırmasından müsəlmanlar arasında məzhəb ixtilafları meydana gəldi, aralarındakı ittihad və ittifaq təfriqə və nifaqla əvəzləndi, Allah-Təalanın ittihad və ittifaqa çağıran Qurani-Şərifindəki açıq ayələri pərdə arxasında gizlədildi, hər bir dəstə, bəlkə, hər bir şəxs özündən ötrü bir məzhəb yaratdı. Hər bir dəstə özünü qurtulmuş dəstə hesab edib, digərlərinə küfr və zındıqlıq isnad etdiyindən bugünkü gündə islam ümməti çobansız bir qoyun dəstəsi kimi, yer üzündə çaşqın şəkildə dolanıb zahirdə qoyun, batində yırtıcı heyvan surətində olan dəstələr onların həyat qaynağı olan qəlblərini öz caynaqlarıyla parçalayıb, yenidən dirilib, ittihad və ittifaq içində olma ümidləri yox olubdur. Ancaq Qurani-Şərifə yapışıb, ixtilafları tərk etsələr, bir ümid var. İlahi, müsəlmanları birləşdirən bir kəlməni qeybdən göndərib, onlara ittihad və ittifaq bəxş eylə!)*

**13)** (اَمْ يَقُولُونَ افْتَرٰيهُ) **- bəlkə, bu müşriklər deyirlər:** (Məhəmməd) **Allah-Təalaya iftira edib** (- mənə Allah-Təaladan vəhy nazil olur, deyir)**.** (قُلْ فَأْتُوا بِعَشْرِ سُوَرٍ مِثْلِهٖ مُفْتَرَيَاتٍ) - (ey Məhəmməd, onlara) **de ki,** (əgər siz deyən kimi mənə vəhy gəlməyib bu Quranı özümdən düzəltmişəmsə, siz də mənim kimi fəsih olan ərəblərsiniz)**, siz də** (özünüzdən) **bu Quran surələri kimi 10 ədəd surə gətirin.** (O vaxt məlum olar ki, mən də sizin kimi bu Quranı özümdən düzəltmişəm)**.** (وَادْعُوا مَنِ اسْتَطَعْتُمْ مِنْ دُونِ اللّٰهِ اِنْ كُنْتُمْ صَادِقٖينَ) – (mən bu Quranı özümdən düzəldib Allah-Təalaya iftira edirəm, sözünüzdə) **əgər doğru deyirsinizsə, Allah-Təaladan başqa** (nə ki qüdrətli şəxsləriniz varsa)**, kimi bacarırsınızsa, çağırın, sizə kömək olsunlar,** (ta ki Quranın müqabilində bir neçə surə düzəldib gətirin. Görəsən, Hz. Peyğəmbər müşriklərə bu sözü deyəndən sonra Qurani-Şərifin müqabilində hər hansı bir surə, ya da bir ayə gətirdilərmi? Əgər gətirsəydilər, hər halda, dünyada qalıb, bizə çatıb, Quran batil olardı. Necə olur ki, şair Züheyr ibn Əbu Sülmanın Haram ibn Sinan və Haris ibn Əvf haqqında dediyi qəsidəsi, İmrüül-Qeysin səhrada əmisi qızı

فَلَّمْ يَسْتَجِيبُوا لَكُمْ فَاعْلَمُوٓا اَنَّمَآ اُنْزِلَ بِعِلْمِ اللّٰهِ وَاَنْ لَآ اِلٰهَ اِلَّا هُوَۚ فَهَلْ اَنْتُمْ مُسْلِمُونَ ﴿١٤﴾ مَنْ
كَانَ يُرِيدُ الْحَيٰوةَ الدُّنْيَا وَزِينَتَهَا نُوَفِّ اِلَيْهِمْ اَعْمَالَهُمْ فِيهَا وَهُمْ فِيهَا لَا يُبْخَسُونَ ﴿١٥﴾ اُولٰٓئِكَ
الَّذِينَ لَيْسَ لَهُمْ فِي الْاٰخِرَةِ اِلَّا النَّارُۘ وَحَبِطَ مَا صَنَعُوا فِيهَا وَبَاطِلٌ مَا كَانُوا يَعْمَلُونَ ﴿١٦﴾

---

Ənizədən ötrü kəsdiyi dəvə ətinin barəsində dediyi şeirləri, Külsüm ibn Əmrin Hirə sultanı Əmr ibn Hindi qətlə yetirmək barəsində iftixar məqsədilə dediyi qəsidəsi və bunlardan başqa cahiliyyə zamanında olan şairlərin şeirləri bizə gəlib çatsın, amma Qüreyş camaatının Qurani-Şərifin müqabilində dediyi surələr gəlib çatmasın. Əgər deyilmiş olsaydı, hər halda, gəlib çatardı. Belə məlum olur ki, aciz qalıblar, onların o fəsahət və bəlağətlə Qurani-Şərifin müqabilində aciz qalmaları Quranın haqq olmasına açıq-aşkar dəlil deyilmi?)

**14)** (فَلَّمْ يَسْتَجِيبُوا لَكُمْ) - (Hz. Peyğəmbərə və möminlərə xitabdır). **Əgər müşriklər sizin sözlərinizi qəbul etməyib** (Quranın müqabilində surə gətirməsələr, necə ki gətirmədilər), (فَاعْلَمُوٓا اَنَّمَآ اُنْزِلَ بِعِلْمِ اللّٰهِ) **- bəs o vaxt bilin ki, həqiqətən, Qurani-Şərif Allah-Təalanın elmiylə nazil olub,** (o elm Allah-Təaladan başqa, heç bir şəxsdə ola bilməz. Bu səbəbdən Qurani-Şərif möcüzə olub onun müqabilində bir surə gətirə bilmirlər). (وَاَنْ لَآ اِلٰهَ اِلَّا هُوَ) **- Allah-Təaladan başqa heç bir haqq olan məbud yoxdur,** (فَهَلْ اَنْتُمْ مُسْلِمُونَ) - (bu ayə müsəlmanları islamda sabit etməyə təşviq etməkdən ötrüdür). **Ey müsəlmanlar, ola bilər ki, bu açıq-aşkar dəlil və sübutu görəndən sonra tövhid və islam dinində sabitqədəm və ixlaslı olasınız?** (Biz ərz edirik, ilahi, islamda sabit və möhkəm olmaq bizim məqsədimizdir. Lakin səndən xahişimiz odur ki, bizə yardım bəxş edəsən ki, asi olub islamdan kənar olmayaq. İnsan gərək dəlilə tabe olsun. Qurani-Şərifin haqlılığına bu cür aşkar dəlil olandan sonra bu dəlili qəbul etməmək nadanlıq əlamətidir. Belə dəlilə tabe olmayıb başqa dəlil istəyənlərə axmaq və cahil adını vermək lazımdır).

**15)** (مَنْ كَانَ يُرِيدُ الْحَيٰوةَ الدُّنْيَا وَزِينَتَهَا) **- kim ki** (axirətdən üz döndərib, ancaq) **dünya həyatını, zinətini istəyir,** (نُوَفِّ اِلَيْهِمْ اَعْمَالَهُمْ فِيهَا) **- dünyadan ötrü etdiyi əməllərinin əcrini dünyada onlara yetirərik.** (وَهُمْ فِيهَا لَا يُبْخَسُونَ) **- dünyada onların əcrlərindən heç bir şey əskik olmaz** (bədən sağlamlığı, dünya ruzisi, nə lazımdırsa, hamısını verərik).

**16)** (اُولٰٓئِكَ الَّذِينَ لَيْسَ لَهُمْ فِي الْاٰخِرَةِ اِلَّا النَّارُ) **- bu dünyanı istəyib axirəti tərk edən şəxslərdən ötrü od əzabından başqa, bir şey yoxdur,** (وَحَبِطَ مَا صَنَعُوا فِيهَا) **- dünyada işlədikləri xeyir əməlləri axirətdə puç olar,** (onların o əməldən məqsədi axirət olmadığından, Allah-Təala yanında bir əcr və savabları olmaz). (وَبَاطِلٌ مَا كَانُوا يَعْمَلُونَ) **- o əməl özü özlüyündə də batildir, çünki doğruluq üzrə vaqe olmayıbdır, batil əmələ nə əcr və savab verilsin?**

اَفَمَنْ كَانَ عَلٰى بَيِّنَةٍ مِنْ رَبِّهٖ وَيَتْلُوهُ شَاهِدٌ مِنْهُ وَمِنْ قَبْلِهٖ كِتَابُ مُوسٰٓى اِمَامًا وَرَحْمَةًۜ اُولٰٓئِكَ يُؤْمِنُونَ
بِهٖۜ وَمَنْ يَكْفُرْ بِهٖ مِنَ الْاَحْزَابِ فَالنَّارُ مَوْعِدُهُۚ فَلَا تَكُ فِي مِرْيَةٍ مِنْهُ اِنَّهُ الْحَقُّ مِنْ رَبِّكَ وَلٰكِنَّ اَكْثَرَ
النَّاسِ لَا يُؤْمِنُونَ ﴿١٧﴾ وَمَنْ اَظْلَمُ مِمَّنِ افْتَرٰى عَلَى اللّٰهِ كَذِبًاۜ اُولٰٓئِكَ يُعْرَضُونَ عَلٰى رَبِّهِمْ وَيَقُولُ
الْاَشْهَادُ هٰٓؤُلَٓاءِ الَّذِينَ كَذَبُوا عَلٰى رَبِّهِمْۚ اَلَا لَعْنَةُ اللّٰهِ عَلَى الظَّالِمِينَۙ ﴿١٨﴾ اَلَّذِينَ يَصُدُّونَ عَنْ
سَبِيلِ اللّٰهِ وَيَبْغُونَهَا عِوَجًاۜ وَهُمْ بِالْاٰخِرَةِ هُمْ كَافِرُونَ ﴿١٩﴾

---

**17)** (اَفَمَنْ كَانَ عَلٰى بَيِّنَةٍ مِنْ رَبِّهٖ) – (islamın haqq olmasında) **öz rəbbi Allah-Təala tərəfindən açıq-aşkar bir dəlil üzrə olan,** (yəni ağlı ilə islamın haqq olmasını dərk edən), (وَيَتْلُوهُ شَاهِدٌ مِنْهُ) – (ağılla birlikdə Qurani-Şərif də islamın haqq olmasına) **ondan ötrü şahid olsa,** (وَمِنْ قَبْلِهٖ كِتَابُ مُوسٰٓى اِمَامًا وَرَحْمَةً) **- Qurandan qabaq Musanın xalqdan ötrü rəhbər və böyük nemət olan kitabı da** (Tövrat da islamın haqq olmasına) **o şəxsdən ötrü şahid olsa,** (belə dəlillərlə islamın haqq olmasını dərk edən şəxs məqsədi dünya və onun zinəti olan şəxslə bərabər olarmı? Əlbəttə, bərabər olmaz)**.** (اُولٰٓئِكَ يُؤْمِنُونَ بِهٖ) **- belə şəxslər Qurana iman gətirirlər.** (وَمَنْ يَكْفُرْ بِهٖ مِنَ الْاَحْزَابِ) **- hər hansı bir dəstədən olan kəs Quranı inkar etsə,** (فَالنَّارُ مَوْعِدُهُ) **– o şəxsə vəd edilən yer od əzabıdır.** (فَلَا تَكُ فِي مِرْيَةٍ مِنْهُ اِنَّهُ الْحَقُّ مِنْ رَبِّكَ) - (ey Məhəmməd) **- sən Quran haqqında şəkk edənlərdən olma, şəkk edənləri bizə həvalə et, həqiqətən, bu Quran haqq olan kitabdır, sənin rəbbin Allah-Təaladan nazil olubdur.** (وَلٰكِنَّ اَكْثَرَ النَّاسِ لَا يُؤْمِنُونَ) **- lakin insanların çoxu Qurana iman gətirən deyil,** (onun haqq olmasına fikir verməyib arzularına tabe olub Quranı inkar edirlər)**.**

**18)** (وَمَنْ اَظْلَمُ مِمَّنِ افْتَرٰى عَلَى اللّٰهِ كَذِبًا) – (özündən söz düzəldib) **Allah-Təalaya yalan isnad edən şəxsdən daha zalım kimdir?** (اُولٰٓئِكَ يُعْرَضُونَ عَلٰى رَبِّهِمْ) – (Allah-Təalaya yalan isnad edənləri qiyamət günü haqq-hesab üçün saxlayıb)**, onlar** (əməlləri) **Allah-Təalanın hüzuruna götürülər.** (Onlar o əməlləri inkar edərlər. O vaxt da onlardan ötrü şahid gətirərlər). (وَيَقُولُ الْاَشْهَادُ هٰٓؤُلَٓاءِ الَّذِينَ كَذَبُوا عَلٰى رَبِّهِمْ) **- şahidlər şəhadət verib deyirlər: “Rəbləri** (Allah-Təalaya qarşı) **yalan deyənlər bunlardır.”** (Hər bir peyğəmbər və möminlər öz qövmlərinin Allah-Təalaya qarşı yalan dediyinə şəhadət edərlər)**.** (اَلَا لَعْنَةُ اللّٰهِ عَلَى الظَّالِمِينَ)– (o vaxtda deyilər: “Ey məhşər əhli, indi ki, bu yalançıların yalanı aşkar oldu, bundan xəbərdar olun ki,) **Allah-Təalanın lənəti** (yalançı) **zalımlara şamildir** (yalançı da zalımdır)**.”**

**19)** (اَلَّذِينَ يَصُدُّونَ عَنْ سَبِيلِ اللّٰهِ) **- o şəxslər ki,** (xalqı) **Allah-Təala yolundan saxlayıb** (islama daxil olmasına mane olurlar), (وَيَبْغُونَهَا عِوَجًا) – (islamdan ötrü) **əyrilik** (və nöqsan axtarıb) **istəyib,** (həmişə islamı əyriliklə vəsf edirlər ki, xalq islama daxil olmasın)**.** (وَهُمْ بِالْاٰخِرَةِ هُمْ كَافِرُونَ) **- əlbəttə, onlar axirəti inkar**

اُو۬لٰٓئِكَ لَمْ يَكُونُوا مُعْجِزٖينَ فِي الْاَرْضِ وَمَا كَانَ لَهُمْ مِنْ دُونِ اللّٰهِ مِنْ اَوْلِيَٓاءَۢ يُضَاعَفُ لَهُمُ الْعَذَابُۜ
مَا كَانُوا يَسْتَطٖيعُونَ السَّمْعَ وَمَا كَانُوا يُبْصِرُونَ ﴿٢٠﴾ اُو۬لٰٓئِكَ الَّذٖينَ خَسِرُٓوا اَنْفُسَهُمْ وَضَلَّ عَنْهُمْ
مَا كَانُوا يَفْتَرُونَ ﴿٢١﴾ لَا جَرَمَ اَنَّهُمْ فِي الْاٰخِرَةِ هُمُ الْاَخْسَرُونَ ﴿٢٢﴾ اِنَّ الَّذٖينَ اٰمَنُوا وَعَمِلُوا
الصَّالِحَاتِ وَاَخْبَتُٓوا اِلٰى رَبِّهِمْۙ اُو۬لٰٓئِكَ اَصْحَابُ الْجَنَّةِۚ هُمْ فٖيهَا خَالِدُونَ ﴿٢٣﴾ مَثَلُ الْفَرٖيقَيْنِ
كَالْاَعْمٰى وَالْاَصَمِّ وَالْبَصٖيرِ وَالسَّمٖيعِۜ هَلْ يَسْتَوِيَانِ مَثَلًاۜ

---

**edən şəxslərdir.** (Bu səbəbdən islamda nöqsan axtarıb, onu xalqın nəzərində qüsurlu göstərirlər).

**20)** (اُو۬لٰٓئِكَ لَمْ يَكُونُوا مُعْجِزٖينَ فِي الْاَرْضِ) – (axirətə kafir olan) **bunlar Allah-Təalanı dünyada onlara əzab etməkdən aciz edən deyildirlər.** (Əgər Allah-Təala istəsəydi, onlara əzab edərdi), (وَمَا كَانَ لَهُمْ مِنْ دُونِ اللّٰهِ مِنْ اَوْلِيَٓاءَ) – (dünyada) **Allah-Təaladan başqa, onlara kömək olub** (Allah-Təalanın əzabından saxlayan da) **yox idi.** (يُضَاعَفُ لَهُمُ الْعَذَابُ) – (dünyada Allah-Təala onlara əzab etmədi, əzablarını axirətə saxladı, axirətdəki əzabları dünya əzabından artıq olub onlara) **çox şiddətli əzab olunacaqdır.** (مَا كَانُوا يَسْتَطٖيعُونَ السَّمْعَ) - (axirət əzabına düçar olanların dünyada Allah-Təalanın haqq sözlərini) **eşitməyə dözümləri yox idi,** (sanki qulaqları, həqiqətən, kar olmuşdu, halbuki, həqiqətən, kar deyildilər, bəlkə, haqq sözə qarşı kar olmuşdular). (وَمَا كَانُوا يُبْصِرُونَ)- **haqqı görən də deyildilər,** (haqqı görməyə qarşı gözləri kor olmuşdu, bu səbəbdən axirət günündə Allah-Təalanın əzabına düçar olarlar).

**21)** (اُو۬لٰٓئِكَ الَّذٖينَ خَسِرُٓوا اَنْفُسَهُمْ) – **onlar** (axirəti inkar edib Allah-Təalaya asi olanlar) **özlərinə ziyan verib** (axirət əzabını seçdilər), (وَضَلَّ عَنْهُمْ مَا كَانُوا يَفْتَرُونَ) **- yalandan Allah-Təalaya şərik qoşub,** (şəfaətini ümid etdikləri də, qiyamət günü) **onlardan qaib olub,** (onlara fayda verməyəcəkdir).

**22)** (لَا جَرَمَ اَنَّهُمْ فِي الْاٰخِرَةِ هُمُ الْاَخْسَرُونَ) – **şübhəsiz ki,** (axirəti inkar edib, Allah-Təalaya şərik qoşanlar) **axirət günündə özlərinə ziyankar olub,** (heç vaxt nicat tapmayacaqlar).

**23)** (اِنَّ الَّذٖينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ وَاَخْبَتُٓوا اِلٰى رَبِّهِمْ) **- həqiqətən, Allah-Təalaya iman gətirib yaxşı əməllər edib, öz rəblərinə ümidvar olub,** (hər bir əməllərini Allah-Təaladan ötrü edənlər), (اُو۬لٰٓئِكَ اَصْحَابُ الْجَنَّةِ هُمْ فٖيهَا خَالِدُونَ) **- cənnətin sahibləridir və həmişə cənnətdə qalacaqlar.**

**24)** (مَثَلُ الْفَرٖيقَيْنِ) **-** (biri Qurana iman gətirib islama daxil olan, o birisi Quranı inkar edən) **iki dəstənin məsəli,** (كَالْاَعْمٰى وَالْاَصَمِّ وَالْبَصٖيرِ وَالسَّمٖيعِ) **- kar və kor şəxsin** (kafirin) **məsəli kimidir** (ki, heç bir şeyi dərk edə bilmir)**, bəsirət sahibi və qulağı açıq olan şəxsin** (möminin) **məsəli kimidirdir** (ki, dünyada hər bir şeyi dərk edib ondan fayda əldə etsin)**.** (هَلْ يَسْتَوِيَانِ مَثَلًا) **– bəs bu**

اَفَلَا تَذَكَّرُونَ﴿٢٤﴾ وَلَقَدْ اَرْسَلْنَا نُوحًا اِلٰى قَوْمِهٖٓ اِنّ۪ي لَكُمْ نَذ۪يرٌ مُب۪ينٌ﴿٢٥﴾ اَنْ لَا تَعْبُدُٓوا اِلَّا اللّٰهَ اِنّ۪ٓي اَخَافُ عَلَيْكُمْ عَذَابَ يَوْمٍ اَل۪يمٍ ﴿٢٦﴾ فَقَالَ الْمَلَاُ الَّذ۪ينَ كَفَرُوا مِنْ قَوْمِه۪ مَا نَرٰيكَ اِلَّا بَشَرًا مِثْلَنَا وَمَا نَرٰيكَ اتَّبَعَكَ اِلَّا الَّذ۪ينَ هُمْ اَرَاذِلُنَا بَادِيَ الرَّاْيِۚ وَمَا نَرٰى لَكُمْ عَلَيْنَا مِنْ فَضْلٍ بَلْ نَظُنُّكُمْ كَاذِب۪ينَ ﴿٢٧﴾ قَالَ يَا قَوْمِ اَرَاَيْتُمْ اِنْ كُنْتُ عَلٰى بَيِّنَةٍ مِنْ رَبّ۪ي

---

**iki dəstə eyni və bərabər olarmı?** (Necə ola bilər ki, bərabər olsunlar?) (اَفَلَا تَذَكَّرُونَ) **– bəs siz** (kafir və müşriklər) **ibrət alıb** (dərk etmirsiniz ki, bu iki dəstə bir-birinə bərabər olmaz. Əgər dərk etsəniz, imanı tərk edib, küfr içində qalmazsınız)**.**

**25)** (وَلَقَدْ اَرْسَلْنَا نُوحًا اِلٰى قَوْمِه۪) **-** (Ey Məhəmməd)**, həqiqətən, biz Nuhu öz qövmünə peyğəmbər göndərdik,** (اِنّ۪ي لَكُمْ نَذ۪يرٌ مُب۪ينٌ) **–** (qövmünü dəvət edib dedi:) **həqiqətən, mən Allah-Təala tərəfindən sizə açıq-aşkar qorxudan** (peyğəmbər olaraq gəlmişəm)**.**

**26)** ( اَنْ لَا تَعْبُدُٓوا اِلَّا اللّٰهَ ) **–** (ey qövm)**, gərək** (yeganə olan) **Allah-Təaladan başqasına ibadət etməyəsiniz,** (اِنّ۪ٓي اَخَافُ عَلَيْكُمْ عَذَابَ يَوْمٍ اَل۪يمٍ)**–** (əgər yeganə olan Allah-Təalaya ibadət etməsəniz)**, həqiqətən, mən** (qiyamət) **gününün şiddətli əzabının sizə vaqe olmasından qorxuram.** (Allah-Təalaya ibadət edin ki, o günün əzabı sizə vaqe olmasın)**.**

**27)** (فَقَالَ الْمَلَاُ الَّذ۪ينَ كَفَرُوا مِنْ قَوْمِه۪) **- Nuhun qövmündən kafir olan böyük şəxslər** (Nuhun cavabında) **dedilər:** (مَا نَرٰيكَ اِلَّا بَشَرًا مِثْلَنَا) **–** (ey Nuh)**, biz səni ancaq özümüz kimi insan görürük,** (əgər insandan peyğəmbər olsa, səndən çox biz peyğəmbərliyə layiqik, insandan peyğəmbər olmaz. Peyğəmbər gərək mələk olsun)**.** (وَمَا نَرٰيكَ اتَّبَعَكَ اِلَّا الَّذ۪ينَ هُمْ اَرَاذِلُنَا بَادِيَ الرَّاْيِ) **–** (ey Nuh)**, biz aramızda olan rəzil və əskik şəxslərdən başqasının sənə tabe olduğunu görmürük,** (onlar da düşünmədən sənə tabe olublar. Əgər əvvəlcədən düşünsəydilər, sənə tabe olmazdılar. Nuha iman gətirənlərin bəzisi yoxsul və miskin olduğundan onları əskik və rəzil hesab etdilər. Bu mətləbi dərk etmədilər ki, Allah-Təalanın yanında mötəbər olan imandır, dünya malı deyil)**.** (وَمَا نَرٰى لَكُمْ عَلَيْنَا مِنْ فَضْلٍ) **–** (ey Nuh)**, sizin** (sənin və sənə tabe olanların dünya malı, ya da başqa bir yöndən) **bizə bir üstünlüyünüzü və fəzilətinizi görmürük** (ki, sizdən peyğəmbər olsun, bizdən olmasın)**.** (بَلْ نَظُنُّكُمْ كَاذِب۪ينَ) **- əksinə, sizin** (peyğəmbərlik iddiasında) **yalançı olduğunuzu güman edirik.** (Yalançı şəxsdən peyğəmbər olmaz)**.** (Ondan sonra Nuhun qövmü ondan möcüzə istədi, Allah-Təala onların cavabında gələn ayəni Nuhdan ötrü qeyd edir, hərçənd onların möcüzə istəməsi ayədə qeyd olunmayıb, amma sıradakı ayə bu mətləbə açıq-aşkar dəlildir)**.**

**28)** (قَالَ يَا قَوْمِ) **–** (Nuh) **dedi: “Ey mənim qövmüm,** (اَرَاَيْتُمْ اِنْ كُنْتُ عَلٰى بَيِّنَةٍ مِنْ رَبّ۪ي) **- mənə xəbər verin, əgər mən öz rəbbim Allah-Təala tərəfindən**

وَاٰتٰينِي رَحْمَةً مِنْ عِنْدِه فَعُمِّيَتْ عَلَيْكُمْۜ اَنُلْزِمُكُمُوهَا وَاَنْتُمْ لَهَا كَارِهُونَ ﴿٢٨﴾ وَيَا قَوْمِ لَٓا اَسْـَٔلُكُمْ
عَلَيْهِ مَالًاۜ اِنْ اَجْرِيَ اِلَّا عَلَى اللّٰهِ وَمَٓا اَنَا بِطَارِدِ الَّذٖينَ اٰمَنُواۜ اِنَّهُمْ مُلَاقُوا رَبِّهِمْ وَلٰكِنّٖيٓ اَرٰيكُمْ قَوْمًا
تَجْهَلُونَ ﴿٢٩﴾ وَيَا قَوْمِ مَنْ يَنْصُرُنٖي مِنَ اللّٰهِ اِنْ طَرَدْتُهُمْۜ اَفَلَا تَذَكَّرُونَ ﴿٣٠﴾ وَلَٓا اَقُولُ لَكُمْ
عِنْدٖي خَزَٓائِنُ اللّٰهِ وَلَٓا اَعْلَمُ الْغَيْبَ

---

**dəlil və sübut üzrə olub** (sizdən ötrü möcüzə gətirsəm, o möcüzə mənim doğruluğuma şəhadət versə), (وَاٰتٰينِي رَحْمَةً مِنْ عِنْدِهٖ) **- Allah-Təala öz yanından mənə rəhmətini** (möcüzə) **bəxş etsə,** ( فَعُمِّيَتْ عَلَيْكُمْ) **- o möcüzənin** (haqq olması) **sizə məxfi qalıb** (haqq tərəfinə hidayət tapmasanız), (اَنُلْزِمُكُمُوهَا وَاَنْتُمْ لَهَا كَارِهُونَ) **- siz o** (möcüzəni) **xoşlamayıb** (qəbul etmədiyiniz) **bir halda mən sizi zorla o** (möcüzəni) **qəbul etməyə vadar edə bilərəmmi?** (Əlbəttə, edə bilmərəm, sizdən ötrü nə sübut və möcüzə gətirsəm də, məndən qəbul etməyəcəksiniz, indi ki qəbul etməyəcəksiniz, sizə möcüzə gətirmək lazım deyil. Bu ayəyə diqqətlə baxıb, ondan sonra peyğəmbərlərdən, xüsusən, bizim peyğəmbərimizdən istənilən möcüzələrin vaqe olub olmaması aydın olar).

**29)** (وَيَا قَوْمِ لَٓا اَسْـَٔلُكُمْ عَلَيْهِ مَالًا) **- Ey mənim qövmüm,** (mən sizə - gəlin Allah-Təaladan başqasına ibadət etməyin, dedikdə)**, sizdən bir mal, mükafat istəmirəm,** (niyə məndən qaçırsınız?) (اِنْ اَجْرِيَ اِلَّا عَلَى اللّٰهِ) **- mənim əcr və mükafatım ancaq Allah-Təalaya aiddir,** (sizdən heç bir şey xahiş etmirəm)**".** (وَمَٓا اَنَا بِطَارِدِ الَّذٖينَ اٰمَنُوا) - (Nuhun ümmətinin böyükləri Nuha dedilər:) **"Sənə iman gətirən əskik və yoxsul şəxsləri yanından uzaqlaşdır ki, bəlkə, biz sənə iman gətirək.** (Nuh onların cavabında deyir:) **"Mən iman gətirən şəxsləri** (öz yanımdan) **qovan deyiləm.** (اِنَّهُمْ مُلَاقُوا رَبِّهِمْ) **- həqiqətən, onlar qiyamət günündə öz rəbləri Allah-Təalanın rəhmətilə qarşılaşacaqlar,** (onları qovan şəxsə Allah-Təala əzab edər, mən onları necə özümdən uzaqlaşdıra bilərəm?) (وَلٰكِنّٖيٓ اَرٰيكُمْ قَوْمًا تَجْهَلُونَ) **- lakin mən sizin cahil və səfehlər kimi danışdığınızı görürəm,** (möminlərə qarşı təkəbbürlü olub, onları əskik hesab edirsiniz)**".**

**30)** (وَيَا قَوْمِ مَنْ يَنْصُرُنٖي مِنَ اللّٰهِ اِنْ طَرَدْتُهُمْ) **- "Ey mənim qövmüm, əgər mən möminləri yanımdan qovub kənar etsəm,** (Allah-Təala onlardan ötrü mənə əzab edib intiqam alar)**, o vaxt mənə kim kömək olub** (Allah-Təalanın əzab və intiqamından saxlayar? Bəs sizdə o qüvvə və qüdrət varmı?) (اَفَلَا تَذَكَّرُونَ) – **bəs fikir verib** (öyüd-nəsihət qəbul etməzsiniz?)"

**31)** (وَلَٓا اَقُولُ لَكُمْ عِنْدٖي خَزَٓائِنُ اللّٰهِ) - (ey qövm)**, mən sizə demirəm ki, mənim yanımda Allah-Təalanın xəzinələri var,** (o vaxt da inkar edib deyəsiniz ki, yalan deyirsən, səndə heç bir dünya malı yoxdur ki, bizdən artıq olasan). (وَلَٓا اَعْلَمُ الْغَيْبَ) **- və qeyb işlərinə də agah olduğumu iddia etmirəm ki, mənə ya-**

وَلَٓا اَقُولُ اِنّ۪ي مَلَكٌ وَلَٓا اَقُولُ لِلَّذ۪ينَ تَزْدَر۪ٓي اَعْيُنُكُمْ لَنْ يُؤْتِيَهُمُ اللّٰهُ خَيْرًاۜ اَللّٰهُ اَعْلَمُ بِمَا ف۪ٓي اَنْفُسِهِمْۚ
اِنّ۪ٓي اِذًا لَمِنَ الظَّالِم۪ينَ ﴿٣١﴾ قَالُوا يَا نُوحُ قَدْ جَادَلْتَنَا فَاَكْثَرْتَ جِدَالَنَا فَأْتِنَا بِمَا تَعِدُنَٓا اِنْ كُنْتَ مِنَ
الصَّادِق۪ينَ ﴿٣٢﴾ قَالَ اِنَّمَا يَأْت۪يكُمْ بِهِ اللّٰهُ اِنْ شَٓاءَ وَمَٓا اَنْتُمْ بِمُعْجِز۪ينَ ﴿٣٣﴾ وَلَا يَنْفَعُكُمْ نُصْح۪ٓي
اِنْ اَرَدْتُ اَنْ اَنْصَحَ لَكُمْ اِنْ كَانَ اللّٰهُ يُر۪يدُ اَنْ يُغْوِيَكُمْۜ هُوَ رَبُّكُمْ وَاِلَيْهِ تُرْجَعُونَۜ ﴿٣٤﴾ اَمْ يَقُولُونَ
افْتَرٰيهُۜ قُلْ اِنِ افْتَرَيْتُهُ فَعَلَيَّ اِجْرَام۪ي وَاَنَا بَر۪ٓيءٌ مِمَّا تُجْرِمُونَ۟ ﴿٣٥﴾

---

**lan və iftira isnad edəsiniz.** (وَلَٓا اَقُولُ اِنّ۪ي مَلَكٌ) **-və sizə demirəm ki, mən** (Allah-Təala tərəfindən gəlmiş) **bir mələyəm,** (siz də deyəsiniz ki, sən də bizim kimi insansan, necə mələk oldun?) (وَلَٓا اَقُولُ لِلَّذ۪ينَ تَزْدَر۪ٓي اَعْيُنُكُمْ لَنْ يُؤْتِيَهُمُ اللّٰهُ خَيْرًا) – (sizə kömək olub, sizinlə bərabər) **həqir və xor gördüyünüz şəxslərə** (möminlərə) **də demirəm ki, Allah-Təala onlara nə dünyada və nə də axirətdə heç bir xeyir və mənfəət verməyəcəkdir.** (Çünki onlar əskik olan şəxsdirlər, necə ki siz deyirsiniz). (اَللّٰهُ اَعْلَمُ بِمَا ف۪ٓي اَنْفُسِهِمْ) **- onların nəfslərində olan** (xeyir və şərə) **Allah-Təala agahdır,** (siz möminləri əskik hesab edirsiniz, amma onların qəlblərində olandan Allah-Təala agahdır), (اِنّ۪ٓي اِذًا لَمِنَ الظَّالِم۪ينَ) **- əgər mən bu sözlərdən birini desəm, həqiqətən, mən o vaxt, əlbəttə, zalımlardan olaram.”**

**32)** (قَالُوا يَا نُوحُ) **- dedilər: “Ey Nuh,** (قَدْ جَادَلْتَنَا فَاَكْثَرْتَ جِدَالَنَا) **- həqiqətən, bizimlə qovğaya başlayıb, çox mübahisə etdin.** (فَأْتِنَا بِمَا تَعِدُنَٓا اِنْ كُنْتَ مِنَ الصَّادِق۪ينَ) **- əgər doğru deyənsənsə, bizə vəd etdiyin əzabı tez gətir.”**

**33)** (قَالَ اِنَّمَا يَأْت۪يكُمْ بِهِ اللّٰهُ اِنْ شَٓاءَ) **- Nuh dedi: “Əgər Allah-Təala istəsə** (və hikməti lazım bilsə)**, hər halda əzabı tezliklə sizə yetirər.** (وَمَٓا اَنْتُمْ بِمُعْجِز۪ينَ) **- siz** (Allah-Təalanı əzab etməkdə) **aciz edən deyilsiniz,** (Allah-Təala nə vaxt istəsə, sizə əzab etməyə qadirdir)**.**

**34)** (وَلَا يَنْفَعُكُمْ نُصْح۪ٓي اِنْ اَرَدْتُ اَنْ اَنْصَحَ لَكُمْ اِنْ كَانَ اللّٰهُ يُر۪يدُ اَنْ يُغْوِيَكُمْ) **- əgər Allah-Təala** (əməlinizə görə) **sizi asilik içində qoyub,** (yardımını sizdən kəsmək istəsə)**, o vaxt da mən sizə nəsihət vermək istəsəm, əlbəttə, mənim nəsihətim sizə fayda verməyəcəkdir.** (هُوَ رَبُّكُمْ) **– sizə tərbiyə verən rəbbiniz Allah-Təaladır,** (onun hakimiyyətindən çıxmağa qadir deyilsiniz. Yardımını sizdən kəsəndən sonra sizə kim hidayət edər?) (وَاِلَيْهِ تُرْجَعُونَ) **- qiyamət günündə qayıdacağınız yer onun tərəfinədir.** (Öz əməlinizə görə sizə əvəz verəcəkdir)**.**

**35)** (اَمْ يَقُولُونَ افْتَرٰيهُ) – (ey Nuh)**, bəlkə, bu camaat deyir ki,** (Nuh Allah-Təalaya) **iftira edib yalandan** – (Allah-Təaladan mənə vəhy nazil olur)**, deyir?** (قُلْ اِنِ افْتَرَيْتُهُ) **- onlara de ki,** (ey Nuh)**, əgər mən** (Allah-Təalaya) **yalandan iftira etsəm,** (فَعَلَيَّ اِجْرَام۪ي) **- öz günahımın** (Allah-Təalaya qarşı yalan deməyimin) **əzabı mənə yetişəcəkdir.** (وَاَنَا بَر۪ٓيءٌ مِمَّا تُجْرِمُونَ) – (amma mən ya-

وَاُوحِيَ اِلٰى نُوحٍ اَنَّهُ لَنْ يُؤْمِنَ مِنْ قَوْمِكَ اِلَّا مَنْ قَدْ اٰمَنَ فَلَا تَبْتَئِسْ بِمَا كَانُوا يَفْعَلُونَ ﴿٣٦﴾
وَاصْنَعِ الْفُلْكَ بِاَعْيُنِنَا وَوَحْيِنَا وَلَا تُخَاطِبْنِي فِي الَّذِينَ ظَلَمُوا اِنَّهُمْ مُغْرَقُونَ ﴿٣٧﴾ وَيَصْنَعُ الْفُلْكَ
وَكُلَّمَا مَرَّ عَلَيْهِ مَلَاٌ مِنْ قَوْمِهِ سَخِرُوا مِنْهُ قَالَ اِنْ تَسْخَرُوا مِنَّا فَاِنَّا نَسْخَرُ مِنْكُمْ كَمَا تَسْخَرُونَ
﴿٣٨﴾ فَسَوْفَ تَعْلَمُونَ مَنْ يَأْتِيهِ عَذَابٌ يُخْزِيهِ وَيَحِلُّ عَلَيْهِ عَذَابٌ مُقِيمٌ ﴿٣٩﴾

---

lançı olmadığımdan)**, sizin etdiyiniz günahın** (mənə isnad etdiyiniz yalan və iftiranın) **əzabından uzağam.** (Onun əzabı sizə yetişəcəkdir)**.**

**36)** (وَاُوحِيَ اِلٰى نُوحٍ) – (bizim tərəfimizdən) **Nuha vəhy olunub deyildi:** (ey Nuh)**,** (اَنَّهُ لَنْ يُؤْمِنَ مِنْ قَوْمِكَ اِلَّا مَنْ قَدْ اٰمَنَ) **- həqiqətən, əlbəttə, öz qövmündən iman gətirənlərdən başqası sənə iman gətirməz,** (daha bundan sonra sənə iman gətirən olmaz)**,** (فَلَا تَبْتَئِسْ بِمَا كَانُوا يَفْعَلُونَ) – (kafirlərin) **etdikləri o əməllərə görə** (səni yalançı və düşmən sayıb, əziyyət etdiklərinə görə) **məhzun və qəmgin olma.**

**37)** (وَاصْنَعِ الْفُلْكَ بِاَعْيُنِنَا وَوَحْيِنَا) – (ey Nuh)**, bizim köməyimiz** (nəzarətimiz) **və sənə vəhy göndərdiyimiz üzrə gəmini düzəlt,** (Nuh, Allah-Təalanın ona bəxş etdiyi ağlın vasitəsilə gəmini düzəltdi, ola bilər ki, ilk gəminin yaradıcısı da Hz. Nuh olsun və belə də ola bilər ki, Nuhun yaşadığı yerdə gəmi olmadığından o yerdə ilk gəmini düzəldən Nuh olsun)**.** (وَلَا تُخَاطِبْنِي فِي الَّذِينَ ظَلَمُوا) - (ey Nuh, ola bilər ki, qövmünə əzab nazil olanda sənin qəlbin onlara yansın, o vaxt da onlara nicat verməkdən ötrü birdən məni çağırarsan. Sənə deyirəm: ey Nuh)**, zalım olan şəxslər barəsində məni çağırma** (və onlardan ötrü şəfaət etmə)**.** (اِنَّهُمْ مُغْرَقُونَ) **- həqiqətən, onların qərq olmağına hökm olunub,** (Allah-Təalanın hökmü dəyişməz. Necə ki hökm olunub, elə də olacaqdır)**.**

**38)** (وَيَصْنَعُ الْفُلْكَ) **- Nuh gəmini düzəltməyə başladı.** (وَكُلَّمَا مَرَّ عَلَيْهِ مَلَاٌ مِنْ قَوْمِهِ سَخِرُوا مِنْهُ) **- Nuh qövmünün böyükləri nə zaman** (ordan) **keçirdilər, gəmiyə baxıb Nuha istehza edirdilər,** (Nuh gəmini bir biyabanda, sudan çox uzaq yerdə düzəldirdi. Nuhun yanına gələnlər deyirdilər: "Ey Nuh, peyğəmbərlikdən sonra dülgər olubsan, bu düzəltdiyin nədir? Nuh deyirdi: "Su üstündə gəzən bir ev düzəldirəm. Onlar bu sözə gülürdülər)**.** (قَالَ اِنْ تَسْخَرُوا مِنَّا فَاِنَّا نَسْخَرُ مِنْكُمْ كَمَا تَسْخَرُونَ) – (Nuh) **dedi:** (ey qövm)**, əgər indi siz bizə istehza edirsiniz, sizin istehza etdiyiniz kimi bir vaxt gələr, biz də sizə istehza edərik.**

**39)** (فَسَوْفَ تَعْلَمُونَ مَنْ يَأْتِيهِ عَذَابٌ يُخْزِيهِ) – **tezliklə biləcəksiniz ki, bizdən və sizdən kimə zəlil edən əzab** (qərq olmaq) **gəlib onu yaxalayacaq?** (وَيَحِلُّ عَلَيْهِ عَذَابٌ مُقِيمٌ) **- və əbədi axirət əzabı kimi yaxalayıb, heç vaxt ondan ayrılmaz?** (Biləcəksiniz ki, o, kimdir)**.** (Nuh gəmini iki ilin içində düzəldib qurtardı. O gəminin uzunluğu 300 arşın, eni 50 arşın, hündürlüyü 30 arşın idi, o gəmini 3

حَتّٰىٓ اِذَا جَآءَ اَمْرُنَا وَفَارَ التَّنُّورُۙ قُلْنَا احْمِلْ فٖيهَا مِنْ كُلٍّ زَوْجَيْنِ اثْنَيْنِ وَاَهْلَكَ اِلَّا مَنْ سَبَقَ عَلَيْهِ الْقَوْلُ وَمَنْ اٰمَنَۜ وَمَٓا اٰمَنَ مَعَهُٓ اِلَّا قَلٖيلٌ ﴿٤٠﴾ وَقَالَ ارْكَبُوا فٖيهَا بِسْمِ اللّٰهِ مَجْرٰيهَا وَمُرْسٰيهَاۜ اِنَّ رَبّٖي لَغَفُورٌ رَحٖيمٌ ﴿٤١﴾

---

mərtəbəli etdi, iki mərtəbəsində heyvanlar, yuxarı mərtəbəsində özləri yerləşdilər, Nuh və ona iman gətirənlər 80 nəfər idi).

**40)** (حَتّٰىٓ اِذَا جَآءَ اَمْرُنَا) – (Nuh gəmini düzəltdi, ta ki müşriklərin qərq olması barəsində) **bizim əmrimizin vaxtı gəlib yetişdi.** (وَفَارَ التَّنُّور) – **təndir qaynayıb coşdu** (yəni tufan başlayıb Nuhun qövmünün işi son dərəcə şiddətli və müşkül oldu, su onları yaxalayıb, çarəsiz qaldılar. Necə ki ərəblər savaş vaxtı adətən belə deyərlər: "Savaş təndiri qızdı". Qurani-Şərifin ayələri də ərəblərin adət-ənənəsinə əsasən gəlmişdir. Təndirdən məqsəd isə çörək təndiri deyil. Tufanın əlaməti su olduğundan burada təndirdə suyun qızması məsəli rəmzlə verilmişdir. Yoxsa bu təndir Kufədə və ya Şamda, ya da Hinddə idi, demək mənasız sözlərdir. Quran ayələrinə belə zəif mənalar verməkdən ərəb dilini və terminlərini bilməməkdən qaynaqlanır. Ayəyə diqqətlə fikir verilsə, dediyimiz mətləb aydın olar). (قُلْنَا احْمِلْ فٖيهَا مِنْ كُلٍّ زَوْجَيْنِ اثْنَيْنِ) – (Nuha vəhy göndərib) **dedik:** (ey Nuh)**, lazım olan zamanda hər heyvandan iki ədəd** (biri dişi, o birisi erkək) **gəmiyə götür.** (وَاَهْلَكَ اِلَّا مَنْ سَبَقَ عَلَيْهِ الْقَوْلُ) **- bir də əleyhlərində əvvəlcədən Allah-Təalanın sözü** (küfr və şirklərinə görə qərq olmaları hökmü) **olanlar** (Nuhun bir oğlu və arvadı) **istisna olmaqla ailəni gəmiyə mindir,** (ancaq o şəxslər sənin ailən deyil, onlardan ötrü nicat yoxdur. Allah-Təala əzəldən bilirdi ki, Nuhun arvadı və oğlu öz ixtiyarları ilə kafir olub qərq olacaqlar). (وَمَنْ اٰمَنَ) **- bir də iman gətirən şəxsləri gəmiyə mindir,** (وَمَٓا اٰمَنَ مَعَهُٓ اِلَّا قَلٖيلٌ)- (bu xitab Hz. Peyğəmbərə təsəlli verməkdən ötrüdür)**,** (ey Məhəmməd, Nuhun qövmündən) **ona ancaq çox azı iman gətirmişdi,** (Nuh çox yaşasa da, ona ancaq 80 nəfər iman gətirmişdi. Yəni ey Məhəmməd, Nuha baxıb təsəlli tap, Məkkə əhlinin sənə iman gətirməməsinə görə üzülmə)**.**

**41)** (وَقَالَ ارْكَبُوا فٖيهَا بِسْمِ اللّٰهِ مَجْرٰيهَا وَمُرْسٰيهَا) **-** (Nuh öz övladlarına və möminlərə) **dedi: "Allah-Təalanın adı ilə gəmiyə minin.** (Yəni Allah-Təalanın adını deyib gəmiyə minin, gəmi su içində) **gedəndə və dayananda onu saxlayan Allah-Təaladır.** (Bu iki kəlmənin qiraətində fərqliliklər vardır. Mən həqirin nəzərində hamısından yaxşısı ismi-fail (sifət bildirən) qiraətidir, (yəni "mucriha və mursiha"). Xalq arasında məşhur olan "məcriha və mursəha" qiraəti səhvdir və belə qiraət heç kimdən nəql olunmayıbdır). (اِنَّ رَبّٖي لَغَفُورٌ رَحٖيمٌ) **-** (Nuh deyir)**: həqiqətən, mənim rəbbim** (günah edib, ondan sonra tövbə edənlərə) **rəhm edib bağışlayandır.** (Nuh özü və tərəfdarları gəmiyə mindilər. Arvadı və bir oğlu isə minmədi)**.**

وَهِيَ تَجْرِي بِهِمْ فِي مَوْجٍ كَالْجِبَالِ وَنَادٰى نُوحٌ ابْنَهُ وَكَانَ فِي مَعْزِلٍ يَا بُنَيَّ ارْكَبْ مَعَنَا وَلَا تَكُنْ مَعَ
الْكَافِرِينَ ﴿٤٢﴾ قَالَ سَاٰوٖي اِلٰى جَبَلٍ يَعْصِمُنِي مِنَ الْمَٓاءِ قَالَ لَا عَاصِمَ الْيَوْمَ مِنْ اَمْرِ اللّٰهِ اِلَّا مَنْ
رَحِمَ وَحَالَ بَيْنَهُمَا الْمَوْجُ فَكَانَ مِنَ الْمُغْرَقِينَ ﴿٤٣﴾ وَقٖيلَ يَٓا اَرْضُ ابْلَعٖي مَٓاءَكِ وَيَا سَمَٓاءُ اَقْلِعٖي
وَغٖيضَ الْمَٓاءُ وَقُضِيَ الْاَمْرُ وَاسْتَوَتْ عَلَى الْجُودِيِّ وَقٖيلَ بُعْدًا لِلْقَوْمِ الظَّالِمٖينَ ﴿٤٤﴾

---

**42)** (وَهِيَ تَجْرِي بِهِمْ فِي مَوْجٍ كَالْجِبَالِ) **- gəmi onları (götürüb) dağlar kimi (hündür) dalğaların arasında aparırdı.** (وَنَادٰى نُوحٌ ابْنَهُ وَكَانَ فِي مَعْزِلٍ يَا بُنَيَّ ارْكَبْ مَعَنَا) **-** (tufan başlayıb, səmadan gələn yağış suyu yeri basanda) **Nuh ondan kənar durub** (gəmiyə) **minməyən oğlunu çağırıb dedi: "Ey mənim oğulcuğum,** (ata oğluna mərhəmətlə belə deyir, Nuhun ürəyi ağrıyıb oğlunu çağırdı ki, bəlkə, qərq olmaqdan nicat tapsın)**, gəl bizimlə gəmiyə min,** (qorxuram qərq olasan)**.** (وَلَا تَكُنْ مَعَ الْكَافِرِينَ) **-** (oğul)**, kafirlərlə birlikdə olmayıb,** (onlara tabe olma, sən də onlar kimi həlak olarsan)**.**

**43)** (قَالَ سَاٰوٖي اِلٰى جَبَلٍ يَعْصِمُنِي مِنَ الْمَٓاءِ) **–** (Nuhun oğlu - Kənan) **dedi: "Gedib bir dağa pənah apararam, məni suya qərq olmaqdan qoruyar** (gəmiyə minməyə ehtiyac yoxdur)**.** (قَالَ لَا عَاصِمَ الْيَوْمَ مِنْ اَمْرِ اللّٰهِ) **–** (Nuh) **dedi:** (ey oğul)**, bugünkü gündə Allah-Təalanın əzabından** (qərq olmaqdan) **qoruyub saxlayan heç bir şey yoxdur.** (اِلَّا مَنْ رَحِمَ) **– ancaq Allah-Təalanın rəhm etdikləri istisnadır,** (Ondan başqa, rəhm edən yoxdur)**.** (وَحَالَ بَيْنَهُمَا الْمَوْجُ)**–** (bu söz-söhbətdən sonra Nuhun oğlu ona itaət etmədi)**, Nuhla arasına dalğa girib,** (فَكَانَ مِنَ الْمُغْرَقِينَ) **- qərq olan kafirlərdən oldu,** (atasının nəsihətinə qulaq asmayıb qərq oldu)**.**

**44)** (وَقٖيلَ يَٓا اَرْضُ ابْلَعٖي مَٓاءَكِ) **–** (Allah-Təala tufanın bitib, yer üzünün təmizlənməsini istədikdə yerə və səmaya əmr edib) **dedi: "Ey yer, suyunu ud.** (وَيَا سَمَٓاءُ اَقْلِعٖي) **- Ey səma, suyunu saxla,** (bu əmrdən sonra səmadan yağış kəsilib, yerin suyu yavaş-yavaş azaldı, necə ki buyurur:) (وَغٖيضَ الْمَٓاءُ) **- sular yer üzündən çəkilib azaldı,** (وَقُضِيَ الْاَمْرُ) **– əmr** (Allah-Təalanın Nuha vəd etdiyi - qövmünü həlak edəcəm əmri) **tamamlandı,** (Nuhun qövmü qərq olub, hamısı həlak oldu)**.** (وَاسْتَوَتْ عَلَى الْجُودِيِّ) **–** (gəmi Mosulda) **Cudi** (adlı dağın) **üstündə oturdu.** (وَقٖيلَ بُعْدًا لِلْقَوْمِ الظَّالِمٖينَ) **–** (Allah-Təala tərəfindən) **deyildi: zalım qövm** (Allah-Təalanın rəhmətindən) **uzaq** (həlak) **olsun.** (Bu ayə son dərəcə fəsahətli və bəlağətli ayədir, demək olar ki, Qurani-Şərifin fəsahət və bəlağətdə ən üstün ayəsidir. Fəsahət və bəlağətin incəliklərini ehtiva edən bir ayədir. Türk dilində o incəlikləri bəyan etməyə imkan olmadığından bundan vaz keçildi)**.**

وَنَادٰى نُوحٌ رَبَّهُ فَقَالَ رَبِّ اِنَّ ابْنِي مِنْ اَهْلِيوَاِنَّ وَعْدَكَ الْحَقُّ وَاَنْتَ اَحْكَمُ الْحَاكِمِينَ ﴿٤٥﴾ قَالَ يَا نُوحُ اِنَّهُ لَيْسَ مِنْ اَهْلِكَۚ

---

**45)** (وَنَادٰى نُوحٌ رَبَّهُ)– (elə ki Nuhun oğlu qərq oldu, oğluna qəlbi yanan) **Nuh öz rəbbi Allah-Təalaya müraciət etdi,** (فَقَالَ رَبِّ اِنَّ ابْنِي مِنْ اَهْلِي) **- dedi: “Ey mənim rəbbim, mənim** (həlak olan bu) **oğlum mənim ailəmdəndir.** (وَاِنَّ وَعْدَكَ الْحَقُّ) **- həqiqətən, sənin vədin isə haqdır.** (Mənə vəd etmişdin ki, ailəmə nicat verəcəksən, bəs niyə oğlum həlak oldu?) (وَاَنْتَ اَحْكَمُ الْحَاكِمِينَ) **- hökm edənlərin ən alimi və adili sənsən.** (Hər bir hökmü elm və ədalət üzrə verirsən, vəd etdiyinə görə də, gərək, oğlum həlak olmayaydı)**.**

**46)** (قَالَ يَا نُوحُ اِنَّهُ لَيْسَ مِنْ اَهْلِكَ) – (Allah-Təala) **buyurdu: “Ey Nuh,** (doğrudur, mən sənə ailənin nicat tapacağını vəd etmişdim, amma həqiqətən, bu oğlun) **sənin ailəndən deyil. (**Sənin ailən Allah-Təalaya iman gətirən saleh* şəxslərdir)**.**

*(*__Qeyd:__ Bu ayə ona işarədir ki, din yaxınlığı soy yaxınlığından üstündür. Həqiqətən də, belədir. Hz. Peyğəmbərin yanında Bilal Həbəşinin dərəcəsi iman gətirməyən bütün qohumlarından üstün idi. Qohum-əqrəba insana o vaxt yaxın olar ki, dində də onunla bərabər olsun. Bu səbəbdən Hz. Peyğəmbər müsəlmanları bir-birilərinə qardaş elan edibdir. Məkkədən Mədinəyə gedəndən sonra hər bir mühaciri (Məkkə əhlini) bir nəfər ənsarla (Mədinə əhli) qardaş etdi ki, özündən sonra da ümmətinin arasında bu gözəl adət yaşasın. Amma heyif, yüz min dəfə heyif, islam ümməti nə Qurana, nə də hədislərə diqqət etməyib, ümmətin ittifaq və ittihadına bais olan belə bir əzəmətli əmri tərk edib, onun əksi - kin və ədavət aralarında yayılıbdır. İslam ümməti bir neçə dəstəyə bölündüyündən, bir-birilərinə zərərverici heyvanlar kimi baxıb, kin və ədavətdən ayrılmırlar. Ömürlərinin əksəriyyətini bir-birilərinin məzhəbini tənqid və məhv etməklə keçirib, hər biri özündən olmayanı küfr və zındıqlıqla ittiham etməyi Allah-Təala yanında böyük əcr və savab hesab edirlər, halbuki islama görə, şərqdə bir müsəlmana bir zərər dəysə, qərbdə olan müsəlman, gərək, ondan ötrü mütəəssir olub, gücü çatan yardımını əsirgəməsin. İslamın ilk rəhbərləri də xalqa insaf və ittihadı əmr, nifaq və nifrəti qadağan ediblər. Harda bir müsəlman camaatı olsa, gərək aralarında ittihad olub, bir yumruq kimi birləşsinlər. Hz.Nuhun əhvalatından ibrət almaq lazımdır ki, Allah-Təala necə də onun oğlunu dindən çıxdığı üçün ailədən kənar sayıb, dənizdə qərq edir. Allah-Təala yanında ən üstün xeyir əməl din qardaşlarına kömək edib, onları zəlalət və cəhalət uçurumundan qurtarmaqdır. Hz. Peyğəmbər öz axır nəfəsində məscidə gəlib halsız olmasına baxmayaraq, necə vəsiyyətlər etmişdir, ən birinci vəsiyyəti müsəlmanların ittihad və ittifaq içində olması, mühaciri ənsara, ənsarı mühacirə tapşırıb, onların bir-birilərinə gözəl münasibət bəsləməsini əmr etmək idi. Onlardan sonra dünyaya gələn müsəlmanlara da bu vəsiyyətlərə riayət etməyi əmr edibdir (biz üzü qaralar da o uca şəxsiyyətin vəsiyyətinə və islama tabe olmalı idik. Ah o gündən ki, o cənabın hüzuruna gedib onunla qarşılaşaq. Vay halımıza).*

اِنَّهُ عَمَلٌ غَيْرُ صَالِحٍ فَلَا تَسْـَٔلْنِ مَا لَيْسَ لَكَ بِهِ عِلْمٌ اِنّ۪ٓي اَعِظُكَ اَنْ تَكُونَ مِنَ الْجَاهِل۪ينَ ﴿٤٦﴾
قَالَ رَبِّ اِنّ۪ٓي اَعُوذُ بِكَ اَنْ اَسْـَٔلَكَ مَا لَيْسَ ل۪ي بِه۪ عِلْمٌ وَاِلَّا تَغْفِرْ ل۪ي وَتَرْحَمْن۪ٓي اَكُنْ مِنَ الْخَاسِر۪ينَ
﴿٤٧﴾ ق۪يلَ يَا نُوحُ اهْبِطْ بِسَلَامٍ مِنَّا وَبَرَكَاتٍ عَلَيْكَ وَعَلٰٓى اُمَمٍ مِمَّنْ مَعَكَ وَاُمَمٌ سَنُمَتِّعُهُمْ ثُمَّ
يَمَسُّهُمْ مِنَّا عَذَابٌ اَل۪يمٌ ﴿٤٨﴾ تِلْكَ مِنْ اَنْبَٓاءِ الْغَيْبِ نُوح۪يهَٓا اِلَيْكَ مَا كُنْتَ تَعْلَمُهَٓا اَنْتَ وَلَا قَوْمُكَ
مِنْ قَبْلِ هٰذَا فَاصْبِرْ

---

(اِنَّهُ عَمَلٌ غَيْرُ صَالِحٍ) - **həqiqətən, onun** (oğlunun) **hər bir əməli** (və özü pis və) **qeyri-salehdir.** (فَلَا تَسْـَٔلْنِ مَا لَيْسَ لَكَ بِهِ عِلْمٌ) - (ey Nuh)**, bilmədiyin şeyi məndən soruşma.** (Sən bilmirsən ki, oğlunun nicat tapması haqqında sual vermək caizdir, yoxsa yox. Bunu bilmədiyin halda, oğlunun nicat tapması haqqında necə sual verərsən? Bunu bilmədiyin üçün gərək belə sual verməyə idin). (اِنّ۪ٓي اَعِظُكَ اَنْ تَكُونَ مِنَ الْجَاهِل۪ينَ) - **həqiqətən,** (ey Nuh)**, sənə öyüd-nəsihət edirəm ki,** (bilmədiyin şeyi soruşub) **cahillərdən olma.**

**47)** (قَالَ رَبِّ اِنّ۪ٓي اَعُوذُ بِكَ اَنْ اَسْـَٔلَكَ مَا لَيْسَ ل۪ي بِه۪ عِلْمٌ) – (Nuh) **dedi: "Ey mənim rəbbim, həqiqətən, bilmədiyim bir şeyi səndən soruşduğum üçün sənə pənah aparıram,** (sənin öyüd-nəsihətini qəbul edib, bundan sonra belə suallar verməərəm. İlahi, məni bağışlayıb günahımdan keç. Bu əməldən tövbə edib sənin tərəfinə dönürəm). (وَاِلَّا تَغْفِرْ ل۪ي وَتَرْحَمْن۪ٓي) – (ilahi)**, əgər məni bağışlamayıb rəhm etməsən,** (اَكُنْ مِنَ الْخَاسِر۪ينَ) - **mən** (öz əməllərimdə) **özümə zərər və ziyan vuranlardan olaram."**

**48)** (ق۪يلَ يَا نُوحُ اهْبِطْ بِسَلَامٍ مِنَّا وَبَرَكَاتٍ عَلَيْكَ) - (ey Məhəmməd, elə ki Nuhun gəmisi Cudi dağında oturdu, bizim tərəfimizdən Nuha) **deyildi: "ey Nuh, bizim tərəfimizdən əmin-amanlıq və sənə olan xeyir-bərəkətlə** (gəmidən çıxıb yer üzünə) **en.** (وَعَلٰٓى اُمَمٍ مِمَّنْ مَعَكَ) - **bir də səninlə birlikdə** (gəmidə) **olan o camaata** (80 nəfərə xeyir və bərəkət olsun)**,** (وَاُمَمٌ سَنُمَتِّعُهُمْ)- (ey Nuh, səninlə birlikdə gəmidə olanlardan) **dünyaya gələcək bəzi ümmətlərə də** (bundan sonra yaxşı və gözəl güzəran) **ləzzət verəcəyik.** (ثُمَّ يَمَسُّهُمْ مِنَّا عَذَابٌ اَل۪يمٌ) – (Allah-Təalanın nemətlərinə nakor olandan sonra dünyada) **bizdən onlara şiddətli əzab yetişər."**

**49)** (تِلْكَ مِنْ اَنْبَٓاءِ الْغَيْبِ نُوح۪يهَٓا اِلَيْكَ) - (ey Məhəmməd, Nuhun bu xəbərləri) **qeyb xəbərlərindəndir. Vəhy edib sənə məlum edirik.** (مَا كُنْتَ تَعْلَمُهَٓا اَنْتَ وَلَا قَوْمُكَ مِنْ قَبْلِ هٰذَا) - (ey Məhəmməd)**, nə sən, nə də sənin qövmün** (Qüreyş, sənə vəhy gəlmədən əvvəl bu xəbərləri) **bilib agah olan deyildi.** (Hz. Peyğəmbər özü və qövmü ümmi olub yazıb-oxuma bilmədiklərindən bu xəbərlər onlardan ötrü qeyb elmi olub, Hz. Peyğəmbərdən ötrü də möcüzə oldu). (فَاصْبِرْ) - (ey Məhəmməd, öz qövmünün əziyyətlərinə) **səbir edib** (Allah-Təalanın hökmlərini onlara çatdır. Necə ki Nuh öz qövmünün əziyyətlərinə xeyli səbir etmişdi)**.**

اِنَّ الْعَاقِبَةَ لِلْمُتَّقِينَ ۚ ﴿٤٩﴾ وَاِلٰى عَادٍ اَخَاهُمْ هُودًاۜ قَالَ يَا قَوْمِ اعْبُدُوا اللّٰهَ مَا لَكُمْ مِنْ اِلٰهٍ غَيْرُهُۜ اِنْ
اَنْتُمْ اِلَّا مُفْتَرُونَ ﴿٥٠﴾ يَا قَوْمِ لَٓا اَسْـَٔلُكُمْ عَلَيْهِ اَجْرًاۜ اِنْ اَجْرِيَ اِلَّا عَلَى الَّذ۪ي فَطَرَن۪يۜ اَفَلَا تَعْقِلُونَ
﴿٥١﴾ وَيَا قَوْمِ اسْتَغْفِرُوا رَبَّكُمْ ثُمَّ تُوبُٓوا اِلَيْهِ يُرْسِلِ السَّمَٓاءَ عَلَيْكُمْ مِدْرَارًا وَيَزِدْكُمْ قُوَّةً اِلٰى قُوَّتِكُمْ

---

(اِنَّ الْعَاقِبَةَ لِلْمُتَّق۪ينَ) - (ey Məhəmməd)**, həqiqətən, aqibət** (kafirlərə qalib olmaq) **müttəqilərdən ötrüdür.** (Necə ki Allah-Təala Nuha nicat verib düşmənlərini qərq etdi. Sənə də nicat verib düşmənlərini zəlil edəcəkdir)**.**

**50)** (وَاِلٰى عَادٍ اَخَاهُمْ هُودًا) – (ey Məhəmməd)**, Ad camaatına qardaşları Hudu** (peyğəmbər göndərdik, qardaş demək özlərindən olan bir nəfər deməkdir)**,** (قَالَ يَا قَوْمِ اعْبُدُوا اللّٰهَ مَا لَكُمْ مِنْ اِلٰهٍ غَيْرُهُ) – (Hud) **dedi: "Ey mənim qövmüm,** (Allah-Təalaya ibadət edib ona şərik qoşmayın)**, sizin üçün Allah-Təaladan başqa, heç bir haqq məbud yoxdur.** (Bu bütlər nədir ki, onlara ibadət edirsiniz?) (اِنْ اَنْتُمْ اِلَّا مُفْتَرُونَ) – (bütlərə sitayiş edib Allah-Təalaya şərik qoşmaqla ancaq) **Allah-Təalaya iftira edirsiniz.**

**51)** (يَا قَوْمِ لَٓا اَسْـَٔلُكُمْ عَلَيْهِ اَجْرًا) **- Ey mənim qövmüm,** (Allah-Təalanın hökmlərini sizə yetirmək üçün) **sizdən heç bir əcr, mükafat istəmirəm.** (اِنْ اَجْرِيَ اِلَّا عَلَى الَّذ۪ي فَطَرَن۪ي) **- mənim əcr və mükafatım ancaq məni yoxdan yaradan Allah-Təaladandır,** (hər bir peyğəmbər bu sözü öz qövmünə deyibdir, çünki peyğəmbərlərin işi öyüd-nəsihət etməkdir. Onların mallarında tamahları olsa, necə nəsihət edə bilərlər?) (اَفَلَا تَعْقِلُونَ) – (ey mənim qövmüm)**, bəs ağlınızla hərəkət etməyəcəksiniz?** (Bir şəxs ki sizdən əcr və mükafat istəmir, onun nəsihətini gərək qəbul edəsiniz, nəinki geri dönüb qulaq asmayasınız, əcr, mükafat istəməyən şəxsin nəsihəti pis niyyətdən uzaq olduğundan, gərək, qəbul olunsun. Amma nəsihət pis bir məqsəddən ötrü, ya da dünya malı məqsədi ilə olsa, o öyüd-nəsihətdən bir fayda olmaz, necə ki bizim zəmanədə olan nəsihətçilərin hamısının nəsihəti pis bir niyyətə əsaslanır. Odur ki, islam ümməti də günbəgün geri gedib, bidətlər zühur edir)**.**

**52)** (وَيَا قَوْمِ اسْتَغْفِرُوا رَبَّكُمْ) **- ey mənim qövmüm, sizə tərbiyə verən rəbbiniz Allah-Təaladan bağışlanmağınızı diləyib** (iman gətirin)**.** (ثُمَّ تُوبُٓوا اِلَيْهِ) **- ondan sonra** (bütlərə sitayiş edib Allah-Təalaya şərik qoşmaqdan) **tövbə edib** (Allah-Təalanın tərəfinə dönün)**.** (يُرْسِلِ السَّمَٓاءَ عَلَيْكُمْ مِدْرَارًا) – (əgər tövbə edib Allah-Təalanın tərəfinə dönsəniz)**, nə vaxt yağışa ehtiyacınız olsa, Allah-Təala da sizə dalbadal yağış göndərər.** (Ad camaatı bağ-bostan sahibləri olduğundan suya çox ehtiyacları var idi, Hud onları ehtiyacları olan şeyi vəd edir ki, bəlkə, imana daxil olsunlar)**.** (وَيَزِدْكُمْ قُوَّةً اِلٰى قُوَّتِكُمْ) **- Allah-Təala sizin qüvvətinizin üstünə daha da qüvvət artırar.** (Ad camaatı fiziki cəhətdən çox güclü-qüvvətli olduğundan Hud onlara daha da çox güc vəd edir ki, ima-

وَلَا تَتَوَلَّوْا مُجْرِمِينَ ﴿٥٢﴾ قَالُوا يَا هُودُ مَا جِئْتَنَا بِبَيِّنَةٍ وَمَا نَحْنُ بِتَارِكِي اٰلِهَتِنَا عَنْ قَوْلِكَ وَمَا نَحْنُ
لَكَ بِمُؤْمِنِينَ ﴿٥٣﴾ اِنْ نَقُولُ اِلَّا اعْتَرٰيكَ بَعْضُ اٰلِهَتِنَا بِسُوٓءٍ قَالَ اِنِّيٓ اُشْهِدُ اللّٰهَ وَاشْهَدُوٓا اَنِّي بَرٓيءٌ
مِمَّا تُشْرِكُونَ ﴿٥٤﴾ مِنْ دُونِهٖ فَكِيدُونِي جَمِيعًا ثُمَّ لَا تُنْظِرُونِ ﴿٥٥﴾

---

na daxil olsunlar). (وَلَا تَتَوَلَّوْا مُجْرِمِينَ) **- günahda israr etdiyiniz halda, mənim** (sözümdən) **üz döndərməyin.**

**53)** (قَالُوا يَا هُودُ مَا جِئْتَنَا بِبَيِّنَةٍ) **-** (Hudun qövmü Huda cavab verib) **dedilər: "Ey Hud, sən bizdən ötrü aşkar olan bir dəlil və sübut gətirməyibsən** (ki, biz də sənə iman gətirək). (وَمَا نَحْنُ بِتَارِكِي اٰلِهَتِنَا عَنْ قَوْلِكَ) **- biz sənin sözünlə məbudlarımıza** (ibadət etməyi) **tərk etmərik.** (وَمَا نَحْنُ لَكَ بِمُؤْمِنِينَ) **- biz sənə iman gətirən deyilik.**

**54-55)** (اِنْ نَقُولُ اِلَّا اعْتَرٰيكَ بَعْضُ اٰلِهَتِنَا بِسُوٓءٍ) **-** (ey Hud, bizim sənə heç bir sözümüz yoxdur)**, ancaq sözümüz budur ki,** (sən bizim məbudlarımıza nalayiq sözlər deyib onlarla ədavət etdiyindən onların bəziləri səndən* intiqam almaq üçün) **sənə qəzəblənibdir,** (sən dəli olubsan, odur ki, dəlilər kimi mənasız danışırsan)**.**

*(*Qeyd: Bax gör ki, cəhalət necə artıbdır, cansız olan şeylərin intiqam aldığına etiqad ediblər. Bu etiqad onların səfehlikdə və cəhalətdə ən uca mərtəbəyə çatdıqlarına işarə edir. Hud camaatı küfr və şirklərində möhkəm olduqlarından bu sözləri təəccüblü deyil, təəccüblü olan odur ki, zahirən müsəlman olan şəxslər də batində müşrik olub, cansız şeyləri, məzar və məqbərələri özlərindən ötrü şəfa vasitəsi sayıb, zərəri dəf edən, xeyir verən hesab edirlər. Sanki Qurani-Şərifin ayələrini eşitməyiblər, Allah-Təala xeyir və zərər verməyi ancaq öz müqəddəs Zatına məxsus sayıb, başqalarını, xüsusən, cansız şeyləri bundan istisna edibdir. Bizim bu dövrdə müsəlmanların gedib bir parça daşlara, ya da məqbərələrə üzlərini sürtüb, onlardan ötrü heyvan qurban edib, yardım istəmələri ilə Ad qövmünün, ya da müşrik Məkkə əhlinin bütlərin qabağında heyvan kəsib, onlardan yardım istəmələri arasında nə fərq var? Diqqətlə baxanda adlarını müsəlman qoyub belə əməllər edən şəxslərin müşriklərdən betər olduğu aydın olur. Onlar zahirən və daxilən özlərini müşrik sayıb, Allah-Təalanın dininə daxil olmaqdan kənar olurdular. Amma bunlar adlarını müsəlman qoyub, bütpərəstlik etməkdə müşriklərdən betər olublar. Ey müsəlmanlar, müsəlman şəxs gərək etiqadını Qurani-Şərifdən alsın. Qurana zidd olan hər şeyi kənara qoymaq lazımdır, Qurani-Şərifin sözlərini kənara qoyub nəfsani arzularla saxta olan sözlərə tabe olmaq islamdan kənar bir işdir. Allah-Təala bizi öz doğru yoluna hidayət etsin. Amin!)*

(قَالَ اِنِّيٓ اُشْهِدُ اللّٰهَ وَاشْهَدُوٓا اَنِّي بَرٓيءٌ مِمَّا تُشْرِكُونَ مِنْ دُونِهٖ) **-** (Hud onların cavabında) **dedi:** (ey qövm)**, həqiqətən, mən Allah-Təalanı şahid tuturam. Siz də buna şahid olun ki, həqiqətən, mən sizin** (Allah-Təalaya) **şərik qoşduqlarınızdan uzağam.** (فَكِيدُونِي جَمِيعًا ثُمَّ لَا تُنْظِرُونِ) – (özünüz və bütlərinizin mənə zərər vermək üçün) **nə ki məkr və hiylə varınızdır, tez edib mənə**

اِنّ۪ي تَوَكَّلْتُ عَلَى اللّٰهِ رَبّ۪ي وَرَبِّكُمْۜ مَا مِنْ دَٓابَّةٍ اِلَّا هُوَ اٰخِذٌ بِنَاصِيَتِهَاۜ اِنَّ رَبّ۪ي عَلٰى صِرَاطٍ مُسْتَق۪يمٍ
﴿٥٦﴾ فَاِنْ تَوَلَّوْا فَقَدْ اَبْلَغْتُكُمْ مَٓا اُرْسِلْتُ بِه۪ٓ اِلَيْكُمْۜ وَيَسْتَخْلِفُ رَبّ۪ي قَوْمًا غَيْرَكُمْۚ وَلَا تَضُرُّونَهُ
شَيْـًٔاۜ اِنَّ رَبّ۪ي عَلٰى كُلِّ شَيْءٍ حَف۪يظٌ ﴿٥٧﴾ وَلَمَّا جَٓاءَ اَمْرُنَا نَجَّيْنَا هُودًا وَالَّذ۪ينَ اٰمَنُوا مَعَهُ بِرَحْمَةٍ
مِنَّاۚ وَنَجَّيْنَاهُمْ مِنْ عَذَابٍ غَل۪يظٍ ﴿٥٨﴾

---

**möhlət verməyin,** (nə sizdən, nə də bütlərinizdən qorxuram, sizin kimi güclü, qüvvətli şəxslərdən qorxmayandan sonra cansız və xeyir-şər verməyə qadir olmayan bütlərinizdən niyə qorxum? Məndən möcüzə istəyirsiniz? Mənim Allah-Təalaya ibadət edib bütlərə ibadəti tərk edin, sözümü qəbul etməyiniz üçün möcüzə lazım deyil, nə təəccüblü söz demişəm ki, ondan ötrü məndən möcüzə istəyirsiniz? Budur, sizin hüzurunuzda durmuşam. Əlinizdən gələni əsirgəməyin. Hz. Hudun vəhyi təbliğ edən bu sözləri çox dəyərli olub, onun sadiq və düz yolda olduğuna işarə edir).

**56)** (اِنّ۪ي تَوَكَّلْتُ عَلَى اللّٰهِ رَبّ۪ي وَرَبِّكُمْ) **- həqiqətən, mən elə bir Allah-Təalaya təvəkkül etmişəm ki, həm mənim rəbbim, tərbiyə verənim, həm də sizin tərbiyə verəninizdir.** (مَا مِنْ دَٓابَّةٍ اِلَّا هُوَ اٰخِذٌ بِنَاصِيَتِهَا) **- yer üzündə elə bir hərəkət edən yoxdur ki, Allah-Təala onun alnından yapışmasın,** (hamısının ixtiyarları Allah-Təaladadır. Necə ki heyvanın alnının tükündən tutanda, heç bir tərəfə gedə bilməz, habelə Allah-Təala da öz qüdrət əliylə yer üzündə olan bütün məxluqatın alnından tutub, onun qüdrət əlindən xilas ola bilməzlər. Siz ki Allah-Təaladan başqa, bütlərə sitayiş edirsiniz, əgər Allah-Təala sizə əzab etmək istəsə, onun qüdrətindən qurtula bilməyəcəksiniz). (اِنَّ رَبّ۪ي عَلٰى صِرَاطٍ مُسْتَق۪يمٍ) **- həqiqətən, mənim rəbbim Allah-Təala** (haqq və ədalətin) **düz yolundadır.** (Hər bir şəxsin öz əməlinə görə, onunla rəftar edəcəkdir).

**57)** (فَاِنْ تَوَلَّوْا) **- əgər məndən üz döndərsəniz,** (Allah-Təaladan mənə heç bir məzəmmət varid olmaz). (فَقَدْ اَبْلَغْتُكُمْ مَٓا اُرْسِلْتُ بِه۪ٓ اِلَيْكُمْ) **- həqiqətən,** (Allah-Təala tərəfindən sizə göndərilən) **hökmləri sizə çatdırdım.** (Bu barədə məndə təqsir yoxdur, təqsir sizdədir ki, Allah-Təalanın hökmlərini qəbul etmirsiniz). (وَيَسْتَخْلِفُ رَبّ۪ي قَوْمًا غَيْرَكُمْ) **- Allah-Təala sizi həlak edib sizin yerinizə başqa bir camaat gətirər.** (وَلَا تَضُرُّونَهُ شَيْـًٔا) **– üz döndərib, iman gətirməməklə Allah-Təalaya heç bir zərər yetirə bilməzsiniz.** (اِنَّ رَبّ۪ي عَلٰى كُلِّ شَيْءٍ حَف۪يظٌ) **- həqiqətən, mənim rəbbim Allah-Təala hər bir şeyə agah olub mühafizə edəndir.** (Sizin əməlləriniz ona məxfi qalmaz, əməllərinizə görə sizə cəza verəcəkdir).

**58)** (وَلَمَّا جَٓاءَ اَمْرُنَا) – (Ad camaatının həlak olması barəsində) **əmrimiz gəlib** (əzabımız onlara gəldiyi zaman). (نَجَّيْنَا هُودًا وَالَّذ۪ينَ اٰمَنُوا مَعَهُ بِرَحْمَةٍ مِنَّا)**- Huda və onunla birlikdə Allah-Təalaya iman gətirənlərə lütf edib öz rəhmətimizi onlara şamil etməklə onlara əzabdan nicat verdik.** (وَنَجَّيْنَاهُمْ مِنْ عَذَابٍ غَل۪يظٍ)

وَتِلْكَ عَادٌ جَحَدُوا بِاٰيَاتِ رَبِّهِمْ وَعَصَوْا رُسُلَهُ وَاتَّبَعُوٓا اَمْرَ كُلِّ جَبَّارٍ عَنِيدٍ ﴿٥٩﴾ وَاُتْبِعُوا فِي هٰذِهِ
الدُّنْيَا لَعْنَةً وَيَوْمَ الْقِيٰمَةِ اَلَآ اِنَّ عَادًا كَفَرُوا رَبَّهُمْ اَلَا بُعْدًا لِعَادٍ قَوْمِ هُودٍ ﴿٦٠﴾ وَاِلٰى ثَمُودَ اَخَاهُمْ
صَالِحًا قَالَ يَا قَوْمِ اعْبُدُوا اللّٰهَ مَا لَكُمْ مِنْ اِلٰهٍ غَيْرُهُ هُوَ اَنْشَاَكُمْ مِنَ الْاَرْضِ وَاسْتَعْمَرَكُمْ فِيهَا

---

**- Hud və ona tabe olanlara şiddətli əzabdan nicat verdik.** (Allah-Təala müşriklərə zəhərli yel (Sam yeli) göndərdi, yel ağızlarına, burunlarına daxil olub, bədənlərini və içalatlarını yandırdı. Özlərini yerə çırpıb həlak oldular)**.**

**59)** (وَتِلْكَ عَادٌ جَحَدُوا بِاٰيَاتِ رَبِّهِمْ) **-** (ey Məhəmməd)**, bu Ad camaatıdır** (ki, onların xəbərləri qeyd olundu. Budur, onların əlamətləri, yer üzündə qalıbdır. Seyr edib onların izlərinə baxın)**, onlar öz rəbləri Allah-Təalanın tövhidinə işarə edən ayə və sübutları inkar etdilər.** (وَعَصَوْا رُسُلَهُ) **- Allah-Təalanın peyğəmbərlərinə asi olub itaət etmədilər.** (وَاتَّبَعُوٓا اَمْرَ كُلِّ جَبَّارٍ عَنِيدٍ) – (Allah-Təalaya asi olub haqqa müxalif olan) **zalım şəxslərin əmrinə tabe oldular** (Hud peyğəmbərə itaət etmədilər)**.**

**60)** (وَاُتْبِعُوا فِي هٰذِهِ الدُّنْيَا لَعْنَةً وَيَوْمَ الْقِيٰمَةِ) **- bu dünyada və axirətdə Allah-Təalanın lənəti onları tutub** (həm dünya, həm də axirətdə əzaba düçar oldular)**.** (اَلَآ اِنَّ عَادًا كَفَرُوا رَبَّهُمْ) **-** (ey Məhəmməd)**, xəbərdar ol, həqiqətən, Ad camaatı öz tərbiyə verən rəbləri Allah-Təalanı inkar etdilər.** (اَلَا بُعْدًا لِعَادٍ قَوْمِ هُودٍ) **-** (ey Məhəmməd)**, yenə xəbərdar ol, Hudun qövmü Ad** (Allah-Təalanın) **rəhmətindən uzaq olub** (həlak oldu)**.** (Hud qövmünün qissəsi tamam oldu, bu qissədə ağıl sahiblərindən ötrü ibrət vardır. Allah-Təalanın məqsədi ancaq qissə anlatmaq deyildir. Əksinə, məqsədi ibrət almağımızdır)**.**

**61)** (وَاِلٰى ثَمُودَ اَخَاهُمْ صَالِحًا) **-** (ey Məhəmməd)**, Səmud camaatına öz tərəfimizdən qardaşları** (yəni özlərindən olan) **Salehi** (peyğəmbər göndərdik)**,** (قَالَ يَا قَوْمِ اعْبُدُوا اللّٰهَ مَا لَكُمْ مِنْ اِلٰهٍ غَيْرُهُ) – (Saleh) **dedi: "Ey mənim qövmüm, yeganə olan Allah-Təalaya ibadət edib** (ona şərik qoşmayın)**. Sizin üçün Allah-Təaladan başqa, haqq məbud yoxdur.** (هُوَ اَنْشَاَكُمْ مِنَ الْاَرْضِ) **– sizi** (siz də onun belində olmaqla babanız Adəmi) **torpaqdan yaradan Allah-Təaladır.** (وَاسْتَعْمَرَكُمْ فِيهَا) **- sizi yaradandan sonra yer üzündə** (yaşayıb) **təmir və abad etməyə* sizi vadar etdi."**

*(*__Qeyd:__ İnsanın yaradılmasının əsas məqsədlərindən biri də yer üzünü abadlaşdırmaq və təmir etmək olduğundan Hz. Saleh öyüd-nəsihətlərində buna diqqət çəkir. Yer üzünün abadlaşdırılması Allah-Təalanın qullarının güzəranının xoş keçməsinə, istirahətlərinə səbəb olduğundan böyük səadət hesab olunmalıdır. Xüsusən, xeyir işlərdə abad və təmir cəmi müsəlmanlara fayda verən əməllərin ilkidir. Bu ayənin mənası zəngin şəxslərə xitab edir. Onlar da, gərək, müsəlmanlara faydalı olan işlərdə xeyriyyəçilik etməyin vacibliyini anlasınlar. Müqəddəs islam şəriətinin rəhbəri Hz. Peyğəmbərin hər bir əməlinə müsəlmanların tabe olması islam dininin*

فَاسْتَغْفِرُوهُ ثُمَّ تُوبُوٓا اِلَيْهِۜ اِنَّ رَبّ۪ي قَر۪يبٌ مُج۪يبٌ ﴿٦١﴾ قَالُوا يَا صَالِحُ قَدْ كُنْتَ ف۪ينَا مَرْجُوًّا قَبْلَ هٰذَٓا اَتَنْهٰينَٓا اَنْ نَعْبُدَ مَا يَعْبُدُ اٰبَٓاؤُ۬نَا وَاِنَّنَا لَف۪ي شَكٍّ مِمَّا تَدْعُونَٓا اِلَيْهِ مُر۪يبٍ ﴿٦٢﴾ قَالَ يَا قَوْمِ اَرَاَيْتُمْ اِنْ كُنْتُ عَلٰى بَيِّنَةٍ مِنْ رَبّ۪ي

---

*şərtlərindəndir. Hz. Peyğəmbər hicrətin əvvəlində Mədinədən iki mil kənarda yerləşən Quba qəsəbəsinə gələndə bir məscid tikilməsini əmr etməsi və özünün də o tikintidə çalışıb, daş daşıması və su çəkməsi müsəlmanlara faydalı olan binaları tikməyə təşəbbüs etmək üçün kafi dəlil deyilmi? Hər bir zamanda o zəmanənin şərtlərinə görə, varlı şəxslər müsəlmanlara lazım olan qurumları tikməyə çalışmalı, o qurumları müqəddəs hesab edib cani-dildən o yolda mallarını sərf etmələri dinin vacib hökmlərindəndir və dinin dirçəldilməsinə vasitədir. Ümmətin övladlarını zillət və cəhalətdən çıxarıb, elm nuru ilə aydınlatmaq üçün məktəb və mədrəsələr tikib, müsəlman uşaqlara mehriban atalar kimi mərhəmət edib, onların həmişəlik nicat tapmalarına səbəb olmaq insanlığın, insafın ilk şərtidir. İslam ölkələrindəki qədim zamanlardan qalan xeyriyyəçilik işlərinin izlərini görənlərə bu mətləb məxfi deyildir. Bu zamanda özgə millətlərin tərəqqisi onların zənginlərinin himməti və bu yolda mal-dövlət xərcləmələri ilə mümkün olmuşdur, müsəlmanların tənəzzülü isə onların zənginlərinin xəsisliklərinin nəticəsidir (İlahi, öz lütfkar nəzərinlə bizə nəzər eylə!)*

(فَاسْتَغْفِرُوهُ ثُمَّ تُوبُوٓا اِلَيْهِ) - (Saleh dedi:) **“Ey qövm, Allah-Təaladan bağışlanmanızı diləyib,** (imana gəlin. Ondan sonra şəkk-şübhə etməkdən) **tövbə edib** (Allah-Təalanın yoluna dönün ki, O da günahlarınızı bağışlasın). (اِنَّ رَبّ۪ي قَر۪يبٌ مُج۪يبٌ) **- həqiqətən, mənim rəbbim Allah-Təalanın** (rəhməti bəndələrinə) **yaxın olub,** (onların dualarını) **qəbul edəndir.**

**62)** (قَالُوا يَا صَالِحُ) – (Salehin qövmü cavab verib) **dedi: “Ey Saleh,** (قَدْ كُنْتَ ف۪ينَا مَرْجُوًّا قَبْلَ هٰذَٓا) **- həqiqətən, sən bizim aramızda bundan qabaq** (gəlin Allah-Təalaya sitayiş edib şərik qoşmayın - sözünü demədən əvvəl mənfəət əldə etməyə) **ümid etdiyimiz biri idin.** (Elə ki bu sözü dedin, səndən ümid kəsildi. Zənn edilməsin ki, bu mətləb ancaq Salehin zamanına məxsusdur, bəlkə, bizim bu zəmanəmizdə də biri Qurani-Şərifin xalqa zidd olan sözlərini onlara deyəndə, o şəxs, sanki, qəribə bir söz demiş kimi onu özlərindən kənar, dinsiz, məzhəbsiz elan edirlər). (اَتَنْهٰينَٓا اَنْ نَعْبُدَ مَا يَعْبُدُ اٰبَٓاؤُ۬نَا) - (ey Saleh)**, bəs bizə ata-babalarımızın ibadət etdiyi bütlərin ibadətini qadağan edirsən?** (Necə ola bilər ki, ata-baba yolunu tərk edək? Müsəlmanlar gözlərini yaxşı açıb bu ayəyə baxsınlar. Ata-babaların qəbih əməllərini təqlid etmək bütpərəstlərin yolunu getməkdir). (وَاِنَّنَا لَف۪ي شَكٍّ مِمَّا تَدْعُونَٓا اِلَيْهِ مُر۪يبٍ) **- həqiqətən, bizi çağırdığın şeydən** (Allah-Təalaya ibadət edib bütləri tərk etmək) **şəkk-şübhə içindəyik,** (iztirab içində olub sənin sözünə etibar etmirik).

**63)** (قَالَ يَا قَوْمِ) – (Saleh) **dedi: “Ey mənim qövmüm,** (اَرَاَيْتُمْ اِنْ كُنْتُ عَلٰى بَيِّنَةٍ مِنْ رَبّ۪ي) **- xəbər verin mənə, əgər mən rəbbim Allah-Təala tərəfindən sözümün**

**وَاٰتٰيني مِنْهُ رَحْمَةً فَمَنْ يَنْصُرُني مِنَ اللّٰهِ اِنْ عَصَيْتُهُ فَمَا تَزيدُونَني غَيْرَ تَخْسيرٍ ﴿٦٣﴾ وَيَا قَوْمِ هٰذِه نَاقَةُ اللّٰهِ لَكُمْ اٰيَةً فَذَرُوهَا تَأْكُلْ فٖي اَرْضِ اللّٰهِ وَلَا تَمَسُّوهَا بِسُوٓءٍ فَيَأْخُذَكُمْ عَذَابٌ قَريبٌ ﴿٦٤﴾ فَعَقَرُوهَا فَقَالَ تَمَتَّعُوا فٖي دَارِكُمْ ثَلٰثَةَ اَيَّامٍ ذٰلِكَ وَعْدٌ غَيْرُ مَكْذُوبٍ ﴿٦٥﴾ فَلَمَّا جَآءَ اَمْرُنَا نَجَّيْنَا صَالِحًا وَالَّذينَ اٰمَنُوا مَعَهُ بِرَحْمَةٍ مِنَّا وَمِنْ خِزْيِ يَوْمِئِذٍ اِنَّ رَبَّكَ هُوَ الْقَوِيُّ الْعَزيزُ ﴿٦٦﴾**

---

**doğruluğuna dəlil və sübut üzrə olsam,** (necə ki eləyəm)**,** (وَاٰتٰيني مِنْهُ رَحْمَةً) **- və Allah-Təala öz tərəfindən mənə rəhmət bəxş edib məni peyğəmbər etsə,** (necə ki təyin edibdir, belə halda əgər mən sizə tabe olub Allah-Təalaya asi olsam, halım necə olar?) (فَمَنْ يَنْصُرُني مِنَ اللّٰهِ اِنْ عَصَيْتُهُ) **- əgər mən Allah-Təalaya asi olsam** (və O, mənə əzab etsə, belə vaxtda) **kim mənə kömək olub Allah-Təalanın əzabından məni xilas edər?** (Siz buna qadirsinizmi?) (فَمَا تَزيدُونَني غَيْرَ تَخْسيرٍ) **–** (əgər mən sizə tabe olsam, siz əməllərimə) **ziyandan başqa bir şey artırmazsınız.** (Mən sizə necə tabe olum? Əgər siz mənə tabe olsanız, məndən sizə xeyir və mənfəət gələr. Ondan sonra Salehin qövmü ondan möcüzə olaraq bir dəvə istədilər, Allah-Təala o möcüzəni Salehə verdi, necə ki sıradakı ayədə buyurur:)

**64)** (وَيَا قَوْمِ هٰذِه نَاقَةُ اللّٰهِ لَكُمْ اٰيَةً) **- "Ey mənim qövmüm, budur, istədiyiniz Allah-Təalanın dəvəsi sizdən ötrü bir möcüzədir.** (فَذَرُوهَا تَأْكُلْ فٖي اَرْضِ اللّٰهِ) **- qoyun o dəvəni Allah-Təalanın yerində olan ot-ələflərdən yesin,** (sizə bir zərəri yoxdur, ondan ötrü bir məsrəf lazım deyildir)**.** (وَلَا تَمَسُّوهَا بِسُوٓءٍ) **–** (o dəvəyə) **zərər yetirmək qəsdiylə ona əl vurmayın.** (فَيَأْخُذَكُمْ عَذَابٌ قَريبٌ) **- o vaxt əzab sizi tez yaxalayar,** (heç gecikməz)**."**

**65)** (فَعَقَرُوهَا) **–** (Allah-Təalanın əmrindən çıxıb)**, dəvənin arxa ayağının damarını kəsib,** (onu həlak etdilər)**.** (فَقَالَ تَمَتَّعُوا فٖي دَارِكُمْ ثَلٰثَةَ اَيَّامٍ) **–** (elə ki Saleh dəvənin öldürüldüyünü gördü,) **dedi:** (indi əzabdan ötrü hazır olun)**. Daha üç gün evinizdə yaşayıb ləzzət alın,** (3 gün sonra sizə əzab gələcəkdir)**.** (ذٰلِكَ وَعْدٌ غَيْرُ مَكْذُوبٍ) **– bu** (sizə verdiyim) **elə vəddir ki, onda yalan yoxdur,** (əlbəttə, vaqe olacaqdır)**.**

**66)** (فَلَمَّا جَآءَ اَمْرُنَا) **–** (əzab barəsində) **əmrimiz** (Salehin qövmünə) **gəldiyində,** (3 gündən sonra əzab onları yaxaladı)**.** (نَجَّيْنَا صَالِحًا وَالَّذينَ اٰمَنُوا مَعَهُ بِرَحْمَةٍ مِنَّا) **– Salehə və onunla bərabər iman gətirənlərə öz rəhmətimizi şamil edib əzabdan nicat verdik.** (وَمِنْ خِزْيِ يَوْمِئِذٍ) **- və ogünkü günün zəlil və xorluğundan** (onlara nicat verdik)**.** (اِنَّ رَبَّكَ هُوَ الْقَوِيُّ الْعَزيز) **-** (ey Məhəmməd)**, həqiqətən, sənin rəbbin** (zalımları həlak edib möminlərə nicat verməkdə) **qüvvət və qüdrət sahibidir.** (Cəmi məxluqatına qalibdir. Heç bir şey ona qalib ola bilməz)**.**

وَاَخَذَ الَّذِينَ ظَلَمُوا الصَّيْحَةُ فَاَصْبَحُوا فِي دِيَارِهِمْ جَاثِمِينَ ﴿٦٧﴾ كَاَنْ لَمْ يَغْنَوْا فِيهَاۜ اَلَٓا اِنَّ ثَمُودَا۟ كَفَرُوا رَبَّهُمْۜ اَلَا بُعْدًا لِثَمُودَ۟ ﴿٦٨﴾ وَلَقَدْ جَٓاءَتْ رُسُلُنَٓا اِبْرٰهِيمَ بِالْبُشْرٰى قَالُوا سَلَامًاۜ قَالَ سَلَامٌ فَمَا لَبِثَ اَنْ جَٓاءَ بِعِجْلٍ حَنِيذٍ ﴿٦٩﴾ فَلَمَّا رَاٰ اَيْدِيَهُمْ لَا تَصِلُ اِلَيْهِ نَكِرَهُمْ وَاَوْجَسَ مِنْهُمْ خِيفَةًۜ قَالُوا لَا تَخَفْ اِنَّٓا اُرْسِلْنَٓا اِلٰى قَوْمِ لُوطٍ ﴿٧٠﴾ وَامْرَاَتُهُ قَٓائِمَةٌ فَضَحِكَتْ فَبَشَّرْنَاهَا بِاِسْحٰقَۙ وَمِنْ وَرَٓاءِ اِسْحٰقَ يَعْقُوبَ ﴿٧١﴾

---

**67)** (وَاَخَذَ الَّذِينَ ظَلَمُوا الصَّيْحَةُ) – (Salehin qövmünü) **şiddətli** (qəlb yaran) **səs yaxalayıb** (فَاَصْبَحُوا فِي دِيَارِهِمْ جَاثِمِينَ) – (o səsin səbəbinə) **hamısı öz yurdlarında dizləri üstə çöküb** (üzü üstə uzanıb həlak oldular)**.**

**68)** (كَاَنْ لَمْ يَغْنَوْا فِيهَا) **- sanki, o yurdlarında heç sakin olmayıb ömürlərini o yerdə keçirməmişdilər.** (اَلَٓا اِنَّ ثَمُودَا۟ كَفَرُوا رَبَّهُمْ) **-** (ey Məhəmməd)**, xəbərdar ol, Səmud camaatı** (Salehin qövmü) **rəbləri Allah-Təalanı inkar etmişdi.** (Bu səbəbdən əzab onları yaxaladı)**,** (اَلَا بُعْدًا لِثَمُودَ) **-** (ey Məhəmməd)**, xəbərdar ol, Səmud camaatı** (Allah-Təalanın rəhmətindən) **uzaq olub** (həlak oldu. Səmud camaatının qissəsi bitdi. Ağıllı şəxslər gərək bu qissədən ibrət alsınlar)**.**

**69)** (وَلَقَدْ جَٓاءَتْ رُسُلُنَٓا اِبْرٰهِيمَ بِالْبُشْرٰى) **-** (ey Məhəmməd)**, həqiqətən, bizim elçilərimiz** (mələklər) **İbrahimin hüzuruna müjdə verməkdən ötrü gəldilər ki,** (Allah-Təala Saradan sənə oğul bəxş edəcək)**.** (قَالُوا سَلَامًا قَالَ سَلَامٌ) – (gəlib İbrahimə) **salam verdilər,** (İbrahim də onların cavabında) **salam dedi.** (Mələklər insan surətində İbrahimin yanına gəlmişdilər. İbrahim onları qonaq sayıb, onlardan ötrü yemək hazılatdı)**.** (فَمَا لَبِثَ اَنْ جَٓاءَ بِعِجْلٍ حَنِيذٍ) – (Hz. İbrahim yemək gətirmək üçün tələsib) **dərhal gedib onlardan ötrü buzov kababı gətirdi.** (Yeməyi qonaqların qabağına qoydu. Qonaqlar yemək yemədilər)**.**

**70)** (فَلَمَّا رَاٰ اَيْدِيَهُمْ لَا تَصِلُ اِلَيْهِ) **- İbrahim qonaqların əllərinin yeməyə uzanmadığını,** (yemək yemədiklərini) **gördükdə,** (نَكِرَهُمْ وَاَوْجَسَ مِنْهُمْ خِيفَةً) – (onların kimliyini) **bilməyib qorxdu** (ki, görən niyə yemək yemirlər? Qonaqlar İbrahimin halını gördülər)**.** (قَالُوا لَا تَخَفْ اِنَّٓا اُرْسِلْنَٓا اِلٰى قَوْمِ لُوطٍ) **- dedilər:** ("Ey İbrahim)**, bizdən qorxma, biz Allah-Təala tərəfindən Lut qövmünə** (onları həlak etməkdən ötrü) **göndərilmişik."**

**71)** (وَامْرَاَتُهُ قَٓائِمَةٌ فَضَحِكَتْ) **- İbrahimin arvadı** (Sara) **onların xidmətində durmuşdu. Dərhal aybaşı oldu,** (mələklər Allah-Təalanın ona (Saradan) oğul verəcəyinə dair müjdə ilə gəlmişdilər. Sara aybaşıdan kəsilmiş və 90 yaşı olduğu halda, (necə övladı olacaq) ondan ötrü əlamət olsun deyə Sara dərhal aybaşı oldu)**.**(فَبَشَّرْنَاهَا بِاِسْحٰقَ) – (Saraya) **İshaqı müjdə verdik,** (yəni Allah-Təala sənə İshaq adlı bir oğul verəcəkdir)**,** (وَمِنْ وَرَٓاءِ اِسْحٰقَ يَعْقُوبَ) **- İshaq-**

قَالَتْ يَا وَيْلَتٰىٓ ءَاَلِدُ وَاَنَا۬ عَجُوزٌ وَهٰذَا بَعْلِي شَيْخًاۜ اِنَّ هٰذَا لَشَيْءٌ عَجِيبٌ ﴿٧٢﴾ قَالُوٓا اَتَعْجَبِينَ مِنْ
اَمْرِ اللّٰهِ رَحْمَتُ اللّٰهِ وَبَرَكَاتُهُ عَلَيْكُمْ اَهْلَ الْبَيْتِۜ اِنَّهُ حَم۪يدٌ مَج۪يدٌ ﴿٧٣﴾ فَلَمَّا ذَهَبَ عَنْ اِبْرٰه۪يمَ الرَّوْعُ
وَجَٓاءَتْهُ الْبُشْرٰى يُجَادِلُنَا ف۪ي قَوْمِ لُوطٍ ﴿٧٤﴾ اِنَّ اِبْرٰه۪يمَ لَحَل۪يمٌ اَوَّاهٌ مُن۪يبٌ ﴿٧٥﴾

---

**dan sonra Yaqub** (İshaq oğlunu ona müjdə verdik. Sara İshaqın oğlu Yaqubu görənə qədər yaşadı)**.**

**72)** (قَالَتْ يَا وَيْلَتٰىٓ ءَاَلِدُ وَاَنَا عَجُوزٌ) **-** (Sara təəccüblə) **dedi: "Vay halıma, bəs mən** (90 yaşında) **qoca arvad olduğum halda, doğacağam?** (وَهٰذَا بَعْلِي شَيْخًا) **- bu da** (İbrahim) **mənim qoca ərimdir,** (necə olur ki, qoca kişinin və qoca arvadın övladı olsun?) (اِنَّ هٰذَا لَشَيْءٌ عَجِيبٌ) **- həqiqətən bu, təəccüblü bir şeydir.** (Sara Allah-Təalanın qoca kişiyə və qoca arvada övlad verə bilmə qüdrətini inkar etmədi, lakin təəccüb etdi)**.**

**73)** (قَالُوٓا اَتَعْجَبِينَ مِنْ اَمْرِ اللّٰهِ) **- mələklər dedilər: "**(ey Sara)**, bəs Allah-Təalanın əmrinə** (qoca vaxtı sizə övlad verməsinə) **təəccüb edirsən?"** (Sara peyğəmbər ailəsində yaşayıb, fövqəladə hallara və möcüzələrə çox şahid olduğundan onun təəccüblənməsi qəribə sayılıb, mələkləri heyrətləndirdi)**.** (رَحْمَتُ اللّٰهِ وَبَرَكَاتُهُ عَلَيْكُمْ اَهْلَ الْبَيْتِ) – (ey Sara, sən bu əmrə təəccüb etmə)**, Allah-Təalanın rəhməti və bərəkətləri** (Allahın dostu olan) **siz ev əhlinə şamildir.** (Bu kimi rəhmətləri sizə çox yetişibdir. Bu əmrə təəccüb etmək sizə layiq deyil)**.** (اِنَّهُ حَمِيدٌ مَجِيدٌ) **- həqiqətən, Allah-Təala həmd-səna olunmağa layiqdir.** (Bəndələrinə) **çox lütf və ehsan edəndir.**

**74)** (فَلَمَّا ذَهَبَ عَنْ اِبْرٰهِيمَ الرَّوْعُ وَجَٓاءَتْهُ الْبُشْرٰى) **- İbrahim** (qonaqları tanıyıb)**, qorxusu çəkilib, ona** (övlad) **müjdəsi gəldikdə** (qəlbi aram və arxayın oldu)**.** (يُجَادِلُنَا فِي قَوْمِ لُوطٍ) **- bizimlə Lut qövmünün** (həlak olması barəsində) **mücadilə etməyə başladı.** (İbrahim dedi: "Əgər Lut qövmünün arasında 50 nəfər müsəlman şəxs olsa, Allah-Təala onları həlak edər?" Mələklər dedilər: "Etməz." Dedi: "40 nəfər olsa necə?" Dedilər: "Həlak etməz." Dedi: "30 nəfər olsa?" Dedilər: "Həlak etməz". Ta yetişdi 10 nəfər, dedilər: "Həlak etməz." Dedi: "Əgər bir nəfər müsəlman olsa, necə?" Dedilər: "Yenə həlak etməz." O vaxt İbrahim dedi: "Bəs Lut nədir? Onların arasındadır." (Lut, İbrahimin qardaşı Haranın oğludur. Ona ürəyi yandığından bu sözü dedi. Mələklər dedilər: "Biz bilirik, Lut oradadır. Allah-Təala ona nicat verəcəkdir." O vaxt İbrahimin qəlbi Luta görə rahat oldu)**.**

**75)** (اِنَّ اِبْرٰهِيمَ لَحَلِيمٌ اَوَّاهٌ مُنِيبٌ) **-** (ey Məhəmməd)**, həqiqətən, İbrahim həlim biri idi.** (Ona pislik edənə cavab verməkdə tələsməzdi)**. Çox yalvarıb-yaxaran,** (tövbə edib) **Allah-Təalaya yönələn idi.** (İbrahimdə bu xüsusiyyətlər olduğundan Lut barəsində mübahisə etdi)**.**

يَآ اِبْرٰهِيمُ اَعْرِضْ عَنْ هٰذَاۚ اِنَّهُ قَدْ جَآءَ اَمْرُ رَبِّكَۚ وَاِنَّهُمْ اٰتِيهِمْ عَذَابٌ غَيْرُ مَرْدُودٍ ﴿٧٦﴾ وَلَمَّا جَآءَتْ رُسُلُنَا لُوطًا سِٓيءَ بِهِمْ وَضَاقَ بِهِمْ ذَرْعًا وَقَالَ هٰذَا يَوْمٌ عَصِيبٌ ﴿٧٧﴾ وَجَآءَهُ قَوْمُهُ يُهْرَعُونَ اِلَيْهِ وَمِنْ قَبْلُ كَانُوا يَعْمَلُونَ السَّيِّـَٔاتِ قَالَ يَا قَوْمِ هٰٓؤُلَٓاءِ بَنَاتِي هُنَّ اَطْهَرُ لَكُمْ فَاتَّقُوا اللّٰهَ وَلَا تُخْزُونِ فِي ضَيْفِيۜ اَلَيْسَ مِنْكُمْ رَجُلٌ رَشِيدٌ ﴿٧٨﴾

---

**76)** (يَآ اِبْرٰهِيمُ اَعْرِضْ عَنْ هٰذَا) - (ey Məhəmməd), (İbrahimə xitab edib dedik:) **"Ey İbrahim,** (hərçənd bağışlamaq və rəhm etmək sənin xüsusiyyətindir, amma Lut qövmünün barəsində danışmaqdan) **vaz keç.** (Onda bir fayda yoxdur, onlar bağışlanmağa layiq deyillər. Elə olsalar, Allah-Təala onlara əzab etməz)**.** (اِنَّهُ قَدْ جَآءَ اَمْرُ رَبِّكَ) **- həqiqətən,** (onların əzabı barəsində) **sənin rəbbin Allah-Təalanın əmri gəlibdir.** (Gərək onlara xəbis əməllərinin səbəbinə əzab olunsun)**.** (وَاِنَّهُمْ اٰتِيهِمْ عَذَابٌ غَيْرُ مَرْدُودٍ) **- həqiqətən, onlara dönüşü olmayan bir əzab gələcəkdir,** (o vaxt da İbrahim onların barəsində danışmaqdan əl çəkdi)**.**

**77)** (وَلَمَّا جَآءَتْ رُسُلُنَا لُوطًا سِٓيءَ بِهِمْ) - (mələklər İbrahimin yanından çıxıb, Lutun yanına getdilər, necə ki buyurur:) **bizim elçilərimiz Lutun yanına gəldikdə** (onların gəlməsindən) **Lut qəmgin oldu,** (mələklər kişi surətində Luta gəldiyindən Lut öz qövmünün onlara qarşı şəhvətlə yaxınlaşmalarından qorxdu ki, birdən qonaqlara da sataşarlar və qəmgin oldu)**.** (وَضَاقَ بِهِمْ ذَرْعًا وَقَالَ هٰذَا يَوْمٌ عَصِيبٌ) – (qonaqların səbəbinə Lutun) **qəlbi sıxılıb dedi: "Mənim bu günüm şiddətli bəla və möhnət günüdür."** (Qonaqları götürüb evə apardı, gecə vaxtı qonaqlar Lutun yanına gələndə Lut qəsəbədən kənarda idi. Lutun arvadından başqa, qonaqlardan xəbərdar olan olmadı. Lutun arvadı evdən çıxıb camaata xəbər verdi ki, Luta təzə gözəl qonaqlar gəlib, əgər meyliniz varsa, gəlin. Camaat Lutun evinə gəlib girdi ki, qonaqları aparıb onlarla yaxınlıq etsinlər)**.**

**78)** (وَجَآءَهُ قَوْمُهُ يُهْرَعُونَ اِلَيْهِ) – (Lutun qövmü xəbərdar olandan sonra) **sürətlə** (Lutun) **yanına** (qonaqlardan ötrü) **gəldilər.** (وَمِنْ قَبْلُ كَانُوا يَعْمَلُونَ السَّيِّـَٔاتِ) **- ondan qabaq da** (Lut qövmünün kişiləri öz aralarında) **xəbis** (şəhvani) **əməllər edirdilər.** (Bu səbəbdən buna pis baxmayıb tez Lutun evinə yönəldilər)**.** (قَالَ يَا قَوْمِ هٰٓؤُلَٓاءِ بَنَاتِي هُنَّ اَطْهَرُ لَكُمْ) – (Lut) **dedi: "Ey mənim qövmüm, budur mənim qızlarım,** (sizə verdim)**. Onlar sizin üçün** (daha yaxşı və) **pakizədir.** (Qonaqlarımdan əl çəkin)**.** (فَاتَّقُوا اللّٰهَ) **- Allah-Təaladan qorxub bu əməli tərk edin.** (وَلَا تُخْزُونِ فِي ضَيْفِي) **- məni qonaqlarımın yanında zəlil, xar edib** (pis əllərinizi onlara uzatmayın. Lut qövmünün kişilərinin adəti idi, ora gələn, yoldan keçən hansı kişi olsaydı, tutub şəhvətlə yaxınlaşardılar. Bu çirkin əməllə məşğul olduqlarından qadınları tərk etmişdilər, bu səbəbdən qadınlar da öz aralarında şəhvani əməllə məşğul idilər)**.** (اَلَيْسَ مِنْكُمْ رَجُلٌ رَشِيدٌ) **- bəs sizdən aqil** (və saleh,

قَالُوا لَقَدْ عَلِمْتَ مَا لَنَا فِي بَنَاتِكَ مِنْ حَقٍّ وَاِنَّكَ لَتَعْلَمُ مَا نُرِيدُ ﴿٧٩﴾ قَالَ لَوْ اَنَّ لِي بِكُمْ قُوَّةً اَوْ
اٰوٖٓي اِلٰى رُكْنٍ شَدٖيدٍ ﴿٨٠﴾ قَالُوا يَا لُوطُ اِنَّا رُسُلُ رَبِّكَ لَنْ يَصِلُوٓا اِلَيْكَ فَاَسْرِ بِاَهْلِكَ بِقِطْعٍ مِنَ
الَّيْلِ وَلَا يَلْتَفِتْ مِنْكُمْ اَحَدٌ اِلَّا امْرَاَتَكَ اِنَّهُ مُصٖيبُهَا مَٓا اَصَابَهُمْ اِنَّ مَوْعِدَهُمُ الصُّبْحُ اَلَيْسَ الصُّبْحُ
بِقَرٖيبٍ ﴿٨١﴾

---

haqq tərəfinə hidayət tapan) **bir kişi yoxdur** (ki, bu işdə mənə kömək olub sizi belə qəbih əməldən saxlasın)**.**

**79** (قَالُوا لَقَدْ عَلِمْتَ مَا لَنَا فِي بَنَاتِكَ مِنْ حَقٍّ) **- dedilər: “**(ey Lut)**, həqiqətən, sənin qızlarına qarşı bir arzumuz** (ehtiyacımız) **olmadığını sən bilirsən,** (وَاِنَّكَ لَتَعْلَمُ مَا نُرِيدُ) **- həqiqətən, sən bilirsən ki, biz nə etmək istəyirik.** (Bizim məqsədimiz kişilərdir. Sən isə deyirsən ki, gəlin qızlarımı sizə* verim)**.**

*(*Qeyd: Lut çox izzətli biri idi, amma qonaqlarına görə öz kiçik qızlarından vaz keçməsi çox təəccüblüdür).*

**80)** (قَالَ لَوْ اَنَّ لِي بِكُمْ قُوَّةً) – (Lut) **dedi: “**(ey camaat)**, kaş sizi dəf etməyə mənim qüvvətim olsaydı.** (اَوْ اٰوٖٓي اِلٰى رُكْنٍ شَدٖيدٍ) **– ya da möhkəm bir sığınacağa pənah aparaydım.** (O vaxt sizi dəf edərdim. Amma nə çarə edim, özüm təkəm, sizə də gücüm çatmır. Lut qapısını bağlayıb camaatla elə söhbət edirdi. Qonaqlar içəridə sakit durmuşdular. Camaat Lutun qapını açmayacağını gördükdə divarın üstündən çıxıb endilər. O vaxt da Lutun hər bir tərəfdən çarəsi kəsildi. Mələklər Lutu o halda görəndə, özlərini Luta tanıtdılar)**.**

**81)** (قَالُوا يَا لُوطُ اِنَّا رُسُلُ رَبِّكَ لَنْ يَصِلُوٓا اِلَيْكَ) – (mələklər) **dedilər: “Ey Lut, həqiqətən, biz sənin rəbbin Allah-Təalanın elçiləriyik,** (sənin yanına gəlmişik, aç qapını, daxil olsunlar)**, sənə əziyyət verə bilməzlər.** (Lut qapını açdı, camaat da içəriyə daxil oldu. Cəbrayıl Allah-Təaladan onlara əzab etməyə izin istədi. İzin gəldi. Onların üzünə vurdu, hamısının gözləri kor olub çaşıb qayıtdılar. Bilmədilər, hansı tərəfə getsinlər)**.** (فَاَسْرِ بِاَهْلِكَ بِقِطْعٍ مِنَ الَّيْلِ) - (ey Lut)**, gecənin bir vaxtı ailəni də götürüb, buradan çıx get.** (وَلَا يَلْتَفِتْ مِنْكُمْ اَحَدٌ اِلَّا امْرَاَتَكَ) – (qəsəbədən çıxanda) **sizdən heç kim arxaya dönüb baxmasın, ancaq sənin arvadın istisnadır** (arxaya baxıb həlak olacaq)**.** (Arvadı kafir olduğundan Lut ona bir şey deməyib, sair ailə üzvlərinə bildirdi)**.** (اِنَّهُ مُصٖيبُهَا مَٓا اَصَابَهُمْ) **- həqiqətən, camaata yetişən** (hər bir bəla) **arvadına da yetişəcək.** (اِنَّ مَوْعِدَهُمُ الصُّبْحُ اَلَيْسَ الصُّبْحُ بِقَرٖيبٍ) **- həqiqətən, sübh vaxtı onlara** (əzab nazil olma) **vaxtıdır. Sübhün gəlməsi yaxın deyilmi?** (Lut ailəsini götürüb getdi, yolda arvadı xəbərdar oldu ki, qövmünə əzab gəlir, qayıdıb qövmünə tərəf baxıb dedi: “Vay mənim qövmümə.” O yerdə səmadan gələn daşlardan biri ona dəyib həlak oldu)**.**

فَلَمَّا جَآءَ اَمْرُنَا جَعَلْنَا عَالِيَهَا سَافِلَهَا وَاَمْطَرْنَا عَلَيْهَا حِجَارَةً مِنْ سِجّيلٍ مَنْضُودٍ ﴿٨٢﴾ مُسَوَّمَةً عِنْدَ رَبِّكَ وَمَا هِيَ مِنَ الظَّالِمينَ بِبَعِيدٍ ﴿٨٣﴾ وَاِلٰى مَدْيَنَ اَخَاهُمْ شُعَيْبًا قَالَ يَا قَوْمِ اعْبُدُوا اللّٰهَ مَا لَكُمْ مِنْ اِلٰهٍ غَيْرُهُ وَلَا تَنْقُصُوا الْمِكْيَالَ وَالْمِيزَانَ اِنّيَ اَرٰيكُمْ بِخَيْرٍ وَاِنّيَ اَخَافُ عَلَيْكُمْ عَذَابَ يَوْمٍ مُحيطٍ ﴿٨٤﴾وَيَا قَوْمِ اَوْفُوا الْمِكْيَالَ وَالْميزَانَ بِالْقِسْطِ وَلَا تَبْخَسُوا النَّاسَ اَشْيَآءَهُمْ وَلَا تَعْثَوْا فِي الْاَرْضِ مُفْسِدينَ ﴿٨٥﴾

---

**82)** (فَلَمَّا جَآءَ اَمْرُنَا) - (Lut qövmünün həlak olması barəsində) **bizim əmrimiz gəldiyində** (onlara əzab nazil oldu)**,** (جَعَلْنَا عَالِيَهَا سَافِلَهَا) – **yurdlarının altını üstünə çevirdik.** (Zəlzələdən onların qəsəbələri alt-üst olub, hamısı həlak oldu). (وَاَمْطَرْنَا عَلَيْهَا حِجَارَةً مِنْ سِجّيلٍ) – (dağıdılmış o qəsəbənin əhlinə) **qurumuş palçıqdan daşları yağış kimi yağdırdıq.** (Kimə dəysə, həlak edirdi). (مَنْضُودٍ) – (o daşlar) **peydərpey** (yağış kimi onların üzərinə tökülürdü)**.**

**83)** (مُسَوَّمَةً عِنْدَ رَبِّكَ) - (ey Məhəmməd, o daşlara) **sənin rəbbin Allah-Təala yanında** (Lut qövmünün həlak olmasından ötrü) **əlamət qoyulmuşdu.** (Onlara məxsus olan daşlar idi). (وَمَا هِيَ مِنَ الظَّالِمينَ بِبَعِيدٍ) – (o daşlar) **zalım şəxslərə** (düşməkdən) **uzaq deyildi.** (Yəni şərik və asilər o daşların düşməsi kimi əzablardan gərək qorxsunlar. Lut qövmünün qissəsi bitdi, bir xəbis əməldən ötrü Allah-Təala 7 qəsəbənin camaatını həlak edəndən sonra müsəlmanlar necə cürət edib belə qəbih əməl edir?)

**84)** (وَاِلٰى مَدْيَنَ اَخَاهُمْ شُعَيْبًا) - **Mədyən camaatına qardaşları Şüeybi** (peyğəmbər göndərdik). (قَالَ يَا قَوْمِ اعْبُدُوا اللّٰهَ) – (Şüeyb) **dedi: "Ey mənim qövmüm,** (yeganə olan) **Allah-Təalaya ibadət edib** (ona şərik qoşmayın). (مَا لَكُمْ مِنْ اِلٰهٍ غَيْرُهُ) – **sizin üçün Allah-Təaladan başqa heç bir haqq məbud yoxdur.** (وَلَا تَنْقُصُوا الْمِكْيَالَ وَالْمِيزَانَ) – (alış-veriş edəndə)**, ölçü və çəkini əskiltməyin.** (Artıq alıb əskik satmayın). (اِنّيَ اَرٰيكُمْ بِخَيْرٍ) - **həqiqətən, mən sizi varlı** (xeyir-bərəkət içində) **görürəm.** (Sizə layiq deyil ki, ölçüdə və çəkidə xəyanət edəsiniz). (وَاِنّيَ اَخَافُ عَلَيْكُمْ عَذَابَ يَوْمٍ مُحيطٍ) - **həqiqətən, mən sizi əhatə edib (həlak edən) bir günün əzabından qorxuram."**

**85)** (وَيَا قَوْمِ اَوْفُوا الْمِكْيَالَ وَالْمِيزَانَ بِالْقِسْطِ) - (əvvəlcə Hz. Şüeyb ölçünü və çəkini artıq-əskik etmənin qəbih əməl olduğunu söyləyib, onu qadağan edir, sonra da bu ayədə deyildiyi kimi, ölçü və çəkini düz etməyin yaxşı olduğunu söyləyib, ona əmr edir:) **"Ey mənim qövmüm, ölçünü və çəkini ədalət üzrə düz edin.** (وَلَا تَبْخَسُوا النَّاسَ اَشْيَآءَهُمْ) - **xalqın malını alarkən** (haqqını) **əskiltməyin** (əskik hesablamayın)**.** (Necə ki alış-veriş əhlinin çoxunda bu mətləb görünür)**.** (وَلَا تَعْثَوْا فِي الْاَرْضِ مُفْسِدينَ) - **yer üzündə tüğyan edib fəsad törətməyin.** (Belə əməllər fəsada bais şeylərdir, bunları tərk edin ki, fəsad olmasın)**.**

بَقِيَّتُ اللّٰهِ خَيْرٌ لَكُمْ اِنْ كُنْتُمْ مُؤْمِنِينَ ۚ وَمَٓا اَنَا۬ عَلَيْكُمْ بِحَفِيظٍ ﴿٨٦﴾ قَالُوا يَا شُعَيْبُ اَصَلٰوتُكَ تَأْمُرُكَ
اَنْ نَتْرُكَ مَا يَعْبُدُ اٰبَٓاؤُ۬نَٓا اَوْ اَنْ نَفْعَلَ ف۪ٓي اَمْوَالِنَا مَا نَشٰٓؤُ۬اۜ اِنَّكَ لَاَنْتَ الْحَل۪يمُ الرَّش۪يدُ ﴿٨٧﴾ قَالَ يَا قَوْمِ
اَرَاَيْتُمْ اِنْ كُنْتُ عَلٰى بَيِّنَةٍ مِنْ رَبّ۪ي وَرَزَقَن۪ي مِنْهُ رِزْقًا حَسَنًاۜ وَمَٓا اُر۪يدُ اَنْ اُخَالِفَكُمْ اِلٰى مَٓا اَنْهٰيكُمْ عَنْهُۜ
اِنْ اُر۪يدُ اِلَّا الْاِصْلَاحَ مَا اسْتَطَعْتُۜ وَمَا تَوْف۪يق۪ٓي اِلَّا بِاللّٰهِۜ عَلَيْهِ تَوَكَّلْتُ وَاِلَيْهِ اُن۪يبُ ﴿٨٨﴾

---

**86)** (بَقِيَّتُ اللّٰهِ خَيْرٌ لَكُمْ اِنْ كُنْتُمْ مُؤْمِن۪ينَ) **- əgər möminsinizsə,** (haramdan çəkinəndən sonra) **Allah-Təalanın** (halal olaraq) **verdiyi mənfəət sizin üçün yaxşı** (və gözəldir). (وَمَٓا اَنَا۬ عَلَيْكُمْ بِحَف۪يظٍ) **- mən sizin əməllərinizi qoruyub saxlamaqdan ötrü göndərilməmişəm.** (Bəlkə, pis əməli qadağan edib yaxşı əmələ işarə etməkdən ötrü göndərilmişəm. Necə ki işarə etdim, gəlin mənim sözümə baxın, alış-verişdə dürüst olun)**.”**

**87)** (قَالُوا يَا شُعَيْبُ اَصَلٰوتُكَ تَأْمُرُكَ اَنْ نَتْرُكَ مَا يَعْبُدُ اٰبَٓاؤُ۬نَٓا) **- dedilər: “Ey Şüeyb, bəs sənə namazın əmr edir ki, ata-babalarımızın ibadət etdiyi məbudlara ibadəti tərk etməmizi** (əmr edirsən? Hz. Şüeyb çox namaz qılan olduğundan qövmü onun namazına istehza edib bu sözü dedi). (اَوْ اَنْ نَفْعَلَ ف۪ٓي اَمْوَالِنَا مَا نَشٰٓؤُ۬ا) **- yoxsa** (namazın sənə deyir ki,) **mallarımızla istədiyimiz kimi, istifadə etməyi tərk edib, sən deyən kimi hərəkət edək?** (ey Şüeyb, alış-verişi istədiyimiz kimi edirik, artıq alıb əskik satırıq, sənin nə haqqın var ki, buna mane olasan? Belə məlum olur ki, bu mətləbi sənə namazın əmr edir). (اِنَّكَ لَاَنْتَ الْحَل۪يمُ الرَّش۪يدُ) **-** (ey Şüeyb)**, həqiqətən, sən həlim, ağıllı,** (hər bir şeydən düz xəbərdarsan, (bizə yaxşı, gözəl sözlər deyirsən, bu sözü istehza məqsədilə dedilər)”**.**

**88)** (قَالَ يَا قَوْمِ اَرَاَيْتُمْ اِنْ كُنْتُ عَلٰى بَيِّنَةٍ مِنْ رَبّ۪ي) – (Şüeyb) **dedi: “Ey mənim qövmüm, mənə xəbər verin görüm, əgər mən açıq-aşkar dəlil üzrə Allah-Təala tərəfindən olub,** (həqiqətən, peyğəmbər olsam), (وَرَزَقَن۪ي مِنْهُ رِزْقًا حَسَنًا) **- Allah-Təala öz tərəfindən mənə halal ruzilər versə,** (belə vaxtda necə ola bilər ki, mən sizə Allah-Təalaya ibadət edib günahları tərk etməyi əmr etməyim? Belə şey necə ola bilər? Halbuki mən Allah-Təalanın sizə göndərdiyi peyğəmbərəm. Gərək sizə yaxşı əməlləri əmr edib, pis əməlləri qadağan edəm). (وَمَٓا اُر۪يدُ اَنْ اُخَالِفَكُمْ اِلٰى مَٓا اَنْهٰيكُمْ عَنْهُ) **- mənim məqsədim o deyil ki, sizə qadağan etdiyim şeyləri özüm sizdən qabaq edim,** (bəlkə,* əvvəlcə özüm onları tərk edib, ondan sonra o şeyləri sizə qadağan edirəm. Belə olan halda, yenə mənim sözümə qulaq asmayıb, itaət etmirsiniz). (اِنْ اُر۪يدُ اِلَّا الْاِصْلَاحَ مَا اسْتَطَعْتُ) **- mən ancaq sizi gücüm çatdığı qədər** (pislikdən qurtarıb) **islah edib** (yaxşılığa götürmək) **istəyirəm.** (وَمَا تَوْف۪يق۪ٓي اِلَّا بِاللّٰهِ) **- mənim müvəffəq olub** (haqqa qovuşmağım) **ancaq Allah-Təalanın köməyi ilədir,** (عَلَيْهِ تَوَكَّلْتُ وَاِلَيْهِ اُن۪يبُ) **– bütün işlərimdə Allah-Təalaya təvəkkül etmişəm və** (hər bir bəla və müsibətdə) **Ona yönəlirəm.**

وَيَا قَوْمِ لَا يَجْرِمَنَّكُمْ شِقَاقِي اَنْ يُصِيبَكُمْ مِثْلُ مَآ اَصَابَ قَوْمَ نُوحٍ اَوْ قَوْمَ هُودٍ اَوْ قَوْمَ صَالِحٍ وَمَا قَوْمُ
لُوطٍ مِنْكُمْ بِبَعِيدٍ ﴿٨٩﴾ وَاسْتَغْفِرُوا رَبَّكُمْ ثُمَّ تُوبُوآ اِلَيْهِ اِنَّ رَبِّي رَحِيمٌ وَدُودٌ ﴿٩٠﴾ قَالُوا يَا شُعَيْبُ
مَا نَفْقَهُ كَثِيرًا مِمَّا تَقُولُ وَاِنَّا لَنَرٰيكَ فِينَا ضَعِيفًا وَلَوْلَا رَهْطُكَ لَرَجَمْنَاكَ وَمَآ اَنْتَ عَلَيْنَا بِعَزِيزٍ ﴿٩١﴾

---

*(*Qeyd: vaiz gərək əvvəlcə özü öyüd-nəsihəti qəbul edib, ondan sonra xalqa vəz etsin. Allah-Təala Hz. İsaya buyurur: "Ey İsa, əvvəlcə özün öyüd-nəsihəti qəbul edib, ondan sonra xalqa vəz et." İslam vaizlərinin əksəri bu mətləbdən birdəfəlik uzaq olduğundan, hətta o öyüd-nəsihətin əksiylə hərəkət etdiklərindən vəzləri də xalqın nəzərində etibarsız olub, zaman içində onun əksi xalqın içində yayılır).*

**89)** (وَيَا قَوْمِ لَا يَجْرِمَنَّكُمْ شِقَاقِي) **- "Ey mənim qövmüm,** (bundan qorxun ki,) **mənə müxalif olub ədavət etmənizlə** (اَنْ يُصِيبَكُمْ مِثْلُ مَآ اَصَابَ قَوْمَ نُوحٍ اَوْ قَوْمَ هُودٍ اَوْ قَوْمَ صَالِحٍ) **– Nuh, Hud və Saleh qövmlərinə yetişən** (əzabların) **misli sizə yetişib** (o vaxt da əzabdan xilas ola bilməzsiniz. Necə ki onlar xilas ola bilmədilər). (وَمَا قَوْمُ لُوطٍ مِنْكُمْ بِبَعِيدٍ) **- Lut qövmünün** (həlak olma zamanı) **sizdən çox uzaq deyildir.** (Onların əhvalından agahsınız, bununla belə, yenə Allah-Təalaya itaət etməyib, pis əməllərdən tövbə etmirsiniz. Şüeyb öz qövmünə dediyi kimi, biz də islam camaatına deyirik: "Ey islam ümməti, Qoçan şəhəri əhalisinin həlak olma zamanı sizdən çox uzaqda deyil, hamınız ondan xəbərdarsınız. H. 11-ci ildə Allah-Təala o şəhəri zəlzələylə viran edib məxluqatını həlak etdi. Onlardan ibrət alıb, şirk əməllərinizi tərk edin")**.**

**90)** (وَاسْتَغْفِرُوا رَبَّكُمْ) – (ey qövm)**, Allah-Təaladan bağışlanmanızı diləyib** (iman gətirin). (ثُمَّ تُوبُوآ اِلَيْهِ) **- ondan sonra** (Allah-Təalaya şərik qoşmaqdan) **tövbə edin.** (اِنَّ رَبِّي رَحِيمٌ وَدُودٌ) **- həqiqətən, mənim rəbbim Allah-Təala** (bəndələrinə) **rəhm edəndir.** (Dost öz dostuna ehsan edən kimi Allah-Təala da bəndələrinə) **ehsan edəndir.**

**91)** (قَالُوا يَا شُعَيْبُ مَا نَفْقَهُ كَثِيرًا مِمَّا تَقُولُ) **- dedilər: "Ey Şüeyb, dediyin sözlərin çoxunu biz anlamırıq,** (istehza məqsədilə belə dedilər, necə ki bir şəxs digər birinin sözünə etina etməyəndə deyər ki, mən bilmirəm və anlamıram ki, sən nə deyirsən, habelə Şüeybə də etina etməyib belə dedilər)**.** (وَاِنَّا لَنَرٰيكَ فِينَا ضَعِيفًا) **- həqiqətən, biz səni öz aramızda zəif** (biri olaraq) **görürük,** (əgər biz sənə əziyyət etmək istəsək, sən də o qüvvə və qüdrət yoxdur ki, qarşımızda dura biləsən)**.** (وَلَوْلَا رَهْطُكَ لَرَجَمْنَاكَ) **- əgər qohum-əqrəban olmasaydı, hər halda səni daşla vurub** (qətlə yetirərdik). (وَمَآ اَنْتَ عَلَيْنَا بِعَزِيزٍ) **- sən bizim yanımızda hörmətli olan bir şəxs də deyilsən** (ki, sənə hörmət edək. Sənin qohum-əqrəban bizim din üzrə olduğundan sənə əziyyət etmək istəmirik, yoxsa sənin bizim yanımızda heç bir dəyərin yoxdur)"**.**

قَالَ يَا قَوْمِ اَرَهْطِي اَعَزُّ عَلَيْكُمْ مِنَ اللّٰهِ وَاتَّخَذْتُمُوهُ وَرَآءَكُمْ ظِهْرِيًّا اِنَّ رَبِّي بِمَا تَعْمَلُونَ مُحِيطٌ
﴿٩٢﴾وَيَا قَوْمِ اعْمَلُوا عَلٰى مَكَانَتِكُمْ اِنِّي عَامِلٌ سَوْفَ تَعْلَمُونَ مَنْ يَأْتِيهِ عَذَابٌ يُخْزِيهِ وَمَنْ هُوَ
كَاذِبٌ وَارْتَقِبُوا اِنِّي مَعَكُمْ رَقِيبٌ ﴿٩٣﴾ وَلَمَّا جَآءَ اَمْرُنَا نَجَّيْنَا شُعَيْبًا وَالَّذِينَ اٰمَنُوا مَعَهُ بِرَحْمَةٍ مِنَّا
وَاَخَذَتِ الَّذِينَ ظَلَمُوا الصَّيْحَةُ فَاَصْبَحُوا فِي دِيَارِهِمْ جَاثِمِينَ ﴿٩٤﴾ كَاَنْ لَمْ يَغْنَوْا فِيهَا اَلَا بُعْدًا
لِمَدْيَنَ كَمَا بَعِدَتْ ثَمُودُ ﴿٩٥﴾ وَلَقَدْ اَرْسَلْنَا مُوسٰى بِاٰيَاتِنَا وَسُلْطَانٍ مُبِينٍ ﴿٩٦﴾ اِلٰى فِرْعَوْنَ
وَمَلَائِهِ فَاتَّبَعُوا اَمْرَ فِرْعَوْنَ وَمَا اَمْرُ فِرْعَوْنَ بِرَشِيدٍ ﴿٩٧﴾

---

**92)** (قَالَ يَا قَوْمِ) – (Şüeyb) **dedi: "Ey mənim qövmüm,** (اَرَهْطِي اَعَزُّ عَلَيْكُمْ مِنَ اللّٰهِ) **– bəs mənim qohum-əqrəbam sizdən ötrü Allah-Təaladan daha əzizdir?** (Mənə qövmümə görə, əziyyət etmirsiniz, amma Allah-Təalanı düşünməyib sözlərimə qulaq asmırsınız). (وَاتَّخَذْتُمُوهُ وَرَآءَكُمْ ظِهْرِيًّا) **- Allah-Təalanı unudub onun əmrlərini atıb** (itaət etmirsiniz). (اِنَّ رَبِّي بِمَا تَعْمَلُونَ مُحِيطٌ) **- həqiqətən, mənim rəbbim Allah-Təala sizin əməllərinizi əhatə edib,** (əməllərinizdən heç bir şey ona məxfi qalan deyildir)**."**

**93)** (وَيَا قَوْمِ اعْمَلُوا عَلٰى مَكَانَتِكُمْ) **- "Ey mənim qövmüm,** (mənimlə ədavətdə olub, Allah-Təalaya şərik qoşduğunuz halda) **nə istəyirsiniz edin.** (اِنِّي عَامِلٌ) **- həqiqətən, mən də** (Allah-Təalanın verdiyi qüvvət, qüdrət və yardımla) **öz əməlimdəyəm.** (سَوْفَ تَعْلَمُونَ مَنْ يَأْتِيهِ عَذَابٌ يُخْزِيهِ وَمَنْ هُوَ كَاذِبٌ) - (ey qövm)**, əlbəttə, kimə əzab gəlib onu zəlil edəcəyini və kimin yalançı olub** (mənim, yoxsa sizin yalanınızın aşkar olacağını) **biləcəksiniz.** (وَارْتَقِبُوا اِنِّي مَعَكُمْ رَقِيبٌ) – (qiyamət əmrini) **gözləyin, həqiqətən, mən də sizinlə birlikdə gözləyirəm,** (görək yalançı və əzab olunanlar kimlər olacaqdır?)

**94)** (وَلَمَّا جَآءَ اَمْرُنَا) - (ey Məhəmməd, Şüeyb qövmünün həlak olması barəsində) **əmrimiz gəldiyində** (onlara əzab nazil oldu), (نَجَّيْنَا شُعَيْبًا وَالَّذِينَ اٰمَنُوا مَعَهُ بِرَحْمَةٍ مِنَّا) **– Şüeybə və onunla birlikdə bizə iman gətirən şəxslərə rəhmətimizlə** (əzabdan) **nicat verdik.** (وَاَخَذَتِ الَّذِينَ ظَلَمُوا الصَّيْحَةُ) **- zalım** (olan Şüeyb qövmünü isə) **şiddətli bir səs yaxalayıb,** (فَاَصْبَحُوا فِي دِيَارِهِمْ جَاثِمِينَ) – (o səsin səbəbinə) **hamısı öz yurdlarında dizləri** (və sinələri) **üstə çöküb** (həlak oldular)**.**

**95)** (كَاَنْ لَمْ يَغْنَوْا فِيهَا) **- sanki, o yurdlarında heç qalmayıb, ömür sürməmişdilər,** (اَلَا بُعْدًا لِمَدْيَنَ كَمَا بَعِدَتْ ثَمُودُ) - (ey Məhəmməd), **xəbərdar ol, Səmud camaatı** (həlak olub Allah-Təalanın rəhmətindən) **uzaq olduğu kimi Mədyən camaatı da uzaq** (və həlak) **oldu.**

**96-97)** (وَلَقَدْ اَرْسَلْنَا مُوسٰى بِاٰيَاتِنَا وَسُلْطَانٍ مُبِينٍ اِلٰى فِرْعَوْنَ وَمَلَائِهِ) **- həqiqətən, Musanı öz möcüzələrimiz və aşkar olan qüvvətli dəlil və sübutla firona və onun əyanlarına peyğəmbər göndərdik.** (فَاتَّبَعُوا اَمْرَ فِرْعَوْنَ) – (Musaya tabe olmayıb) **fironun əmrinə tabe oldular.** (وَمَا اَمْرُ فِرْعَوْنَ بِرَشِيدٍ) **- halbuki fironun**

يَقْدُمُ قَوْمَهُ يَوْمَ الْقِيٰمَةِ فَاَوْرَدَهُمُ النَّارَ وَبِئْسَ الْوِرْدُ الْمَوْرُودُ ﴿٩٨﴾ وَاُتْبِعُوا فٖي هٰذِهٖ لَعْنَةً وَيَوْمَ
الْقِيٰمَةِ بِئْسَ الرِّفْدُ الْمَرْفُودُ ﴿٩٩﴾ ذٰلِكَ مِنْ اَنْبَٓاءِ الْقُرٰى نَقُصُّهُ عَلَيْكَ مِنْهَا قَٓائِمٌ وَحَصٖيدٌ ﴿١٠٠﴾
وَمَا ظَلَمْنَاهُمْ وَلٰكِنْ ظَلَمُوٓا اَنْفُسَهُمْ فَمَٓا اَغْنَتْ عَنْهُمْ اٰلِهَتُهُمُ الَّتٖي يَدْعُونَ مِنْ دُونِ اللّٰهِ مِنْ شَيْءٍ لَمَّا
جَٓاءَ اَمْرُ رَبِّكَ وَمَا زَادُوهُمْ غَيْرَ تَتْبٖيبٍ ﴿١٠١﴾ وَكَذٰلِكَ اَخْذُ رَبِّكَ اِذَٓا اَخَذَ الْقُرٰى وَهِيَ ظَالِمَةٌ

---

**əmri** (hidayət üzrə) **düz olmayıb** (bəlkə aşkar olan küfr və zəlalət üzrə idi. Çünki küfr və zəlalətə tabe idi. Fironun camaatı nə qədər cahil bir camaat idi ki, hidayəti qoyub zəlalətə tabe oldular)**.**

**98)** (يَقْدُمُ قَوْمَهُ يَوْمَ الْقِيٰمَةِ) – (firon) **qiyamət günündə öz qövmünün qabağına düşüb onlara rəhbər olar.** (فَاَوْرَدَهُمُ النَّارَ) **- onları cəhənnəm oduna varid edər.** (وَبِئْسَ الْوِرْدُ الْمَوْرُودُ) **- varid olacaqları yer nə pis yerdir,** (su gümanı ilə cəhənnəm oduna düşərlər)**.**

**99)** (وَاُتْبِعُوا فٖي هٰذِهٖ لَعْنَةً وَيَوْمَ الْقِيٰمَةِ) **- həm dünyada, həm də axirətdə onlara lənət olunar.** (وَبِئْسَ الْوِرْدُ الْمَوْرُودُ) – (axirət lənətinə kömək edən dünya lənəti) **nə pis köməkdir** (onlar üçün nə pis ərməğandır və əzabın artmasına baisdir).

**100)** (ذٰلِكَ مِنْ اَنْبَٓاءِ الْقُرٰى نَقُصُّهُ عَلَيْكَ) - (ey Məhəmməd)**, bu,** (əhalisi həlak olan) **şəhərlərin bəzi xəbərləridir ki, sənə xəbər verdik.** (Nə pis xəbərlərdir bunlar)**.** (مِنْهَا قَٓائِمٌ وَحَصٖيدٌ) – (o şəhərlərin) **bəzilərinin** (izləri) **durur və bəziləri xarab olub,** (heç bir izi qalmayıbdır)**.**

**101)** (وَمَا ظَلَمْنَاهُمْ) – (o şəhərlərin əhalisini həlak etməklə) **biz onlara zülm etmədik.** (وَلٰكِنْ ظَلَمُوٓا اَنْفُسَهُمْ) **- lakin özləri** (Allah-Təalaya asi olmaq səbəbilə) **özlərinə zülm edib,** (öz əməllərinin cəzasına çatıb həlak oldular)**.** (فَمَٓا اَغْنَتْ عَنْهُمْ اٰلِهَتُهُمُ الَّتٖي يَدْعُونَ مِنْ دُونِ اللّٰهِ مِنْ شَيْءٍ لَمَّا جَٓاءَ اَمْرُ رَبِّكَ) - (ey Məhəmməd, rəbbin Allah-Təalanın əzab əmri onlara gəldikdə)**, Allah-Təaladan başqa çağırıb sitayiş etdikləri məbudlar** (bütlər) **onlara heç bir fayda vermədi.** (وَمَا زَادُوهُمْ غَيْرَ تَتْبٖيبٍ) **- o məbudlar** (bütlər) **onlardan ötrü zərərdən başqa bir şey də artırmadı.** (Bəlkə, o bütlərə ibadət etmək səbəbilə həmişəlik əzaba düçar oldular)**.**

**102)** (وَكَذٰلِكَ اَخْذُ رَبِّكَ اِذَٓا اَخَذَ الْقُرٰى وَهِيَ ظَالِمَةٌ) - (ey Məhəmməd)**, rəbbin Allah-Təala əhalisi* zalım olan məmləkətləri əzabla yaxalayanda belə yaxalayar.** (Necə ki əvvəlki camaatların əhvalatı səndən ötrü qeyd olundu)**.**

*(****Qeyd:*** *zülmün pis olmasında əqli dəlildən başqa, qeyd olunan ayələrin dəlil və sübutu da kafidir. Zülm iki qisimdir, birincisi odur ki, şəxs Allah-Təalaya asi olub vacib əməlləri tərk edib, haramları əmələ gətirməklə özünə zülm edər. İkincisi odur ki, şəxs hər hansı bir insana 5 günlük dünya həyatının mənfəətindən ötrü zülm edib Allah-Təalanın verdiyi əmanətə xəyanət edər. Bu, zülmün ən yüksək dərəcəsidir. Belə şəxs insanlıqdan kənar olub, vəhşilər cərgəsinə daxil olar və insan surətində bir vəhşidir.*

اِنَّ اَخْذَهُ اَلِيمٌ شَدِيدٌ ﴿١٠٢﴾ اِنَّ فِي ذٰلِكَ لَاٰيَةً لِمَنْ خَافَ عَذَابَ الْاٰخِرَةِ ذٰلِكَ يَوْمٌ مَجْمُوعٌ لَهُ
النَّاسُ وَذٰلِكَ يَوْمٌ مَشْهُودٌ ﴿١٠٣﴾ وَمَا نُؤَخِّرُهُ اِلَّا لِاَجَلٍ مَعْدُودٍ ﴿١٠٤﴾ يَوْمَ يَأْتِ لَا تَكَلَّمُ نَفْسٌ
اِلَّا بِاِذْنِهِ فَمِنْهُمْ شَقِيٌّ وَسَعِيدٌ ﴿١٠٥﴾ فَاَمَّا الَّذِينَ شَقُوا فَفِي النَّارِ لَهُمْ فِيهَا زَفِيرٌ وَشَهِيقٌ ﴿١٠٦﴾
خَالِدِينَ فِيهَا مَا دَامَتِ السَّمٰوَاتُ وَالْاَرْضُ اِلَّا مَا شَٓاءَ رَبُّكَ اِنَّ رَبَّكَ فَعَّالٌ لِمَا يُرِيدُ ﴿١٠٧﴾

---

*Birinci zülmün cəzası şəxsin özünə aid olduğundan tövbə şərtiylə Allah-Təalanın bağışlamasını ümid edə bilər. Amma ikinci zülmün bağışlanmasına ümid olmayıb, xəyal etdiyi şəfaətçilərin də ona bir köməyi olmaz və Allah-Təalanın geniş rəhmətindən kənar qalıb həmişəlik lənətə düçar olar).*

(اِنَّ اَخْذَهُ اَلِيمٌ شَدِيدٌ) **- həqiqətən, Allah-Təalanın əzabla yaxalaması son dərəcə şiddətli və əziyyət verəndir.**

**103)** (اِنَّ فِي ذٰلِكَ لَاٰيَةً لِمَنْ خَافَ عَذَابَ الْاٰخِرَةِ) **- həqiqətən, bu** (qeyd olunan camaatların həlak olmasında) **axirət əzabından qorxanlar üçün** (Allah-Təalanın qüdrət və tövhidinə) **dəlil və sübut vardır.** (ذٰلِكَ يَوْمٌ مَجْمُوعٌ لَهُ النَّاسُ) – (axirət) **günü elə bir gündür ki, bütün insanlar o gündən ötrü toplanar.** (Allah-Təala məzlumun intiqamını zalımdan alar). (وَذٰلِكَ يَوْمٌ مَشْهُودٌ) – (qiyamət) **günü elə bir gündür ki, bütün insanlar o gün hazır olub** (heç bir nəfər o gün qeyb ola bilməz).

**104)** (وَمَا نُؤَخِّرُهُ اِلَّا لِاَجَلٍ مَعْدُودٍ) - (ey Məhəmməd), **biz qiyamət gününü ancaq müəyyən bir vaxtadək təxirə salarıq,** (o vaxt ki kölgə gəlib qurtarar, onun axırı qiyamət olar. O vaxtı Allah-Təaladan başqa, heç kim bilməz).

**105)** (يَوْمَ يَأْتِ لَا تَكَلَّمُ نَفْسٌ اِلَّا بِاِذْنِهِ) **- qiyamət günü gəldikdə,** (Allah-Təalanın) **izni olmadan heç kimin danışmağa qüdrəti olmaz.** (فَمِنْهُمْ شَقِيٌّ وَسَعِيدٌ) **- məhşər əhlinin bəziləri** (cəhənnəmliklər) **günahkar və bədbəxt, bəziləri** (cənnətliklər) **də xoşbəxt olar.**

**106)** (فَاَمَّا الَّذِينَ شَقُوا فَفِي النَّارِ لَهُمْ فِيهَا زَفِيرٌ وَشَهِيقٌ) – **bədbəxt olanlar cəhənnəm odunun içində olub, onlardan ötrü orada zorla nəfəs alıb-vermək vardır.** (Yəni əzabın şiddətindən nəfəsləri daralıb, nəfəs alıb vermələri müşkül olar).

**107)** (خَالِدِينَ فِيهَا مَا دَامَتِ السَّمٰوَاتُ وَالْاَرْضُ) **- nə qədər ki səmalar və yer vardır, günahkarlar cəhənnəmdə olarlar.** (اِلَّا مَا شَٓاءَ رَبُّكَ) - (ey Məhəmməd, onlar həmişə cəhənnəm odunda olarlar), **ancaq rəbbin Allah-Təalanın istəməsi istisnadır,** (istəsə, onları cəhənnəm əzabından çıxarıb, başqa bir əzaba – şiddətli soyuqluq əzabına düçar edər). (اِنَّ رَبَّكَ فَعَّالٌ لِمَا يُرِيدُ) - (ey Məhəmməd), **həqiqətən, sənin rəbbin** (cəhənnəm əhli üçün) **nə** (əzab) **istəsə, onu da edər** (və heç bir şey də ona mane olmaz).

وَاَمَّا الَّذِينَ سُعِدُوا فَفِي الْجَنَّةِ خَالِدِينَ فِيهَا مَا دَامَتِ السَّمٰوَاتُ وَالْاَرْضُ اِلَّا مَا شَآءَ رَبُّكَ ۜ عَطَآءً
غَيْرَ مَجْذُوذٍ ﴿١٠٨﴾ فَلَا تَكُ فِي مِرْيَةٍ مِمَّا يَعْبُدُ هٰؤُلَآءِ ۜ مَا يَعْبُدُونَ اِلَّا كَمَا يَعْبُدُ اٰبَآؤُهُمْ مِنْ قَبْلُ ۜ
وَاِنَّا لَمُوَفُّوهُمْ نَصِيبَهُمْ غَيْرَ مَنْقُوصٍ ﴿١٠٩﴾ وَلَقَدْ اٰتَيْنَا مُوسَى الْكِتَابَ فَاخْتُلِفَ فِيهِ ۜ وَلَوْلَا كَلِمَةٌ
سَبَقَتْ مِنْ رَبِّكَ لَقُضِيَ بَيْنَهُمْ ۜ وَاِنَّهُمْ لَفِي شَكٍّ مِنْهُ مُرِيبٍ ﴿١١٠﴾ وَاِنَّ كُلًّا لَمَّا لَيُوَفِّيَنَّهُمْ رَبُّكَ
اَعْمَالَهُمْ ۜ

---

**108)** (وَاَمَّا الَّذِينَ سُعِدُوا فَفِي الْجَنَّةِ خَالِدِينَ فِيهَا مَا دَامَتِ السَّمٰوَاتُ وَالْاَرْضُ) **- amma xoşbəxtlər səmalar və yerlər var olduqca cənnətdə olarlar.** (Qurani-Şərifin sözləri və məsəlləri adət və ənənələrə əsaslandığından Allah-Təala da bu ayələrdə cəhənnəm və cənnətə gedənlərin orada həmişəlik qalacağını fani olan səma və yerin varlığı ilə əlaqələndirdi. Çünki insanlar da bu şəkildə (məsələn, dünya durduqca və s. şəkildə) danışırlar. Cənnət və cəhənnəm əhli isə həmişəlik orada qalıb, heç vaxt ordan çıxmazlar). (اِلَّا مَا شَآءَ رَبُّكَ) **– ancaq rəbbin Allah-Təalanın istəməsi istisnadır,** (istəsə, onlara cənnət nemətlərindən daha böyük nemətlər – öz ilahi rizasını bəxş edib, cənnət nemətlərini onlara unutdurar). (عَطَآءً غَيْرَ مَجْذُوذٍ) – (Allah-Təalanın) **bəxşişi heç kəsilməz.**

**109)** (فَلَا تَكُ فِي مِرْيَةٍ مِمَّا يَعْبُدُ هٰؤُلَآءِ) - (ey Məhəmməd, əvvəlki ümmətlərin qissələrini və bütlərə ibadət etdikləri üçün əzaba düçar olduqlarını sənə bildirəndən sonra) **daha sən** (bu Məkkə müşriklərinin bütlərə) **ibadət etməsinin** (onlara bir faydası olmayıb, əzaba düçar olacaqlarına) **şübhə etmə.** (مَا يَعْبُدُونَ اِلَّا كَمَا يَعْبُدُ اٰبَآؤُهُمْ مِنْ قَبْلُ) - (ey Məhəmməd, bu müşriklər) **ancaq bundan qabaq ata-babalarının ibadət etdiyi kimi** (bütlərə) **ibadət edirlər,** (وَاِنَّا لَمُوَفُّوهُمْ نَصِيبَهُمْ غَيْرَ مَنْقُوصٍ) **- həqiqətən, biz bunlara** (əzab) **haqlarını əskiksiz yetirərik.** (Necə ki ata-babalarına yetirdik, əzabdan heç bir hissələri əskik olmaz).

**110)** (وَلَقَدْ اٰتَيْنَا مُوسَى الْكِتَابَ فَاخْتُلِفَ فِيهِ) - (ey Məhəmməd, peyğəmbərlər arasında itaət olunmayan bir tək sən deyilsən, səndən əvvəlki peyğəmbərlərə bir bax), **həqiqətən, Musaya** (Tövratı) **verib** (onu bəni-İsrailə və firona peyğəmbər göndərdik). **Tövratda ixtilaf etdilər.** (Necə ki Quranda ixtilaf edirlər, bəziləri iman gətirdi, bəziləri də kafir oldu). (وَلَوْلَا كَلِمَةٌ سَبَقَتْ مِنْ رَبِّكَ) - (ey Məhəmməd), **əgər sənin rəbbindən sənin qövmün barəsində bir kəlmə** (və hökm) **keçməsəydi,** (o hökm budur ki, əzabları, gərək, axirətə qalsın), (لَقُضِيَ بَيْنَهُمْ) - (əgər o söz olmasaydı, hər halda sənin rəbbin Allah-Təaladan) **onların arasında hökm olunub** (onlara dünyada əzab olunardı). (وَاِنَّهُمْ لَفِي شَكٍّ مِنْهُ مُرِيبٍ) **- həqiqətən, onlar öz yanlarından** (Quranın) **haqqında şəkk-şübhə içində olub** (özgələrini də) **şübhəyə salırlar.**

**111)** (وَاِنَّ كُلًّا لَمَّا لَيُوَفِّيَنَّهُمْ رَبُّكَ اَعْمَالَهُمْ) - (ey Məhəmməd), **həqiqətən,** (Quran haqqında ixtilaf edib təsdiq, ya təkzib edənlərin) **hamısına sənin rəbbin**

اِنَّهُ بِمَا يَعْمَلُونَ خَبِيرٌ ﴿١١١﴾ فَاسْتَقِمْ كَمَٓا اُمِرْتَ وَمَنْ تَابَ مَعَكَ وَلَا تَطْغَوْاۜ اِنَّهُ بِمَا تَعْمَلُونَ بَصِيرٌ
﴿١١٢﴾ وَلَا تَرْكَنُوٓا اِلَى الَّذِينَ ظَلَمُوا

---

**Allah-Təala öz əməllərinin cəzasını verəcəkdir.** (اِنَّهُ بِمَا يَعْمَلُونَ خَبِيرٌ) **- həqiqətən, Allah-Təala öz bəndələrinin əməllərindən xəbərdardır.** (Heç bir şey ona məxfi qalan deyildir)**.**

**112)** (فَاسْتَقِمْ كَمَٓا اُمِرْتَ وَمَنْ تَابَ مَعَكَ) **-** (ey Məhəmməd, bizim tərəfimizdən) **əmr olunduğun kimi, sən və səninlə birlikdə** (iman gətirənlər, islam üzrə möhkəm və) **düz** (yolda) **olub** (Allah-Təalanın hər bir hökmünə əməl edin)**.** (وَلَا تَطْغَوْا) **- tüğyan edib** (Allah-Təalanın qoyduğu) **həddi aşmayın.** (اِنَّهُ بِمَا تَعْمَلُونَ بَصِيرٌ) **- həqiqətən, Allah-Təala etdiyiniz hər bir əməli görüb onlardah agahdır.** (İbn Abbasdan rəvayət olunubdur, belə deyir: "Qurani-Şərifin ayələrindən heç bir ayə bu "əmr olunduğun kimi düz (yolda) ol" ayəsi kimi Hz. Peyğəmbərə ağır və çətin olmadı və bu səbəbdən də - "Hud surəsi məni qocaltdı", buyurdu" (Tirmizi, Tefsiru-Surə, 56/6))**.**

**113)** (وَلَا تَرْكَنُوٓا اِلَى الَّذِينَ ظَلَمُوا) **- zalım olan şəxslərə az da olsa,* meyil etməyin.**

*(*Qeyd: Bu ayə zalımlara meyil edənlərin barəsindədir. Amma o şəxslər ki, zalımlarla bir yerdə oturub-durur, ya da onları dost tutub elədikləri əməllərə razı olur və ya özlərini zalımlara oxşadıb onlar kimi geyinir, onları tərifləyib əməllərini vəsf edir, belə şəxslərin əzabı daha da çox olacaq. Lakin zalımın özündən ötrü nə əzab vardır, onu ancaq Allah-Təala bilir. Zalımdan pis heç kim ola bilməz, Abbasi xəlifələrindən əl-Müvəffiq Lidinillah imamın arxasında camaat namazı qılırdı, imam Fatihə surəsindən sonra "zalım olan şəxslərə az da olsa* meyil etməyin" ayəsini oxudu, xəlifə bu ayəni eşidən kimi yerə yıxılıb qəşş elədi, bir müddətdən sonra özünə gəldi. Səbəbini soruşdular, dedi: "Bu ayədə Allah-Təala zalım şəxsə meyil edənə əzab vəd edir, bəs zalımın özünün halı necə olacaqdır? Vay zalım şəxslərin halına, öz nəfsani arzuları üçün Allah-Təalanın məxluquna zülm edib Allah-Təalanın həmişəlik qəhr və qəzəbinə düçar olurlar. Kim özünə tabe olan şəxsin haqqına riayət etməyib, onunla ədalətlə rəftar etməsə, o şəxs zalımlardan hesab olunacaqdır. Bir də zalım şəxsə etdiyi zülmün əvəzi axirətdən qabaq dünyada ona yetişəcəkdir və zalımın üzü həmişə qara olar, necə ki şeyx Sədi deyir:*

*"Ey qolçomaq, əlsizlərə çox eyləmə azar,*
*Zənn etmə ki, daim belə qızğın qala bazar".*

*Zalım şəxsə elə bu dünyada zülmünün əvəzinin çatması dünyanın qanunudur. Şeyx Nizami Gəncəvi nə gözəl deyir:*

*Öz gözümlə gördüm ki, səhrada,*
*Bir balaca quş qarışqanın canını aldı.*
*Hələ ki, dimdiyini ovundan ayırmamışdı,*

فَتَمَسَّكُمُ النَّارُ وَمَا لَكُمْ مِنْ دُونِ اللّٰهِ مِنْ اَوْلِيَٓاءَ ثُمَّ لَا تُنْصَرُونَ ﴿١١٣﴾ وَاَقِمِ الصَّلٰوةَ طَرَفَيِ النَّهَارِ
وَزُلَفًا مِنَ الَّيْلِ اِنَّ الْحَسَنَاتِ يُذْهِبْنَ السَّيِّـَٔاتِ ذٰلِكَ ذِكْرٰى لِلذَّاكِرِينَ ﴿١١٤﴾ وَاصْبِرْ فَاِنَّ اللّٰهَ لَا
يُضِيعُ اَجْرَ الْمُحْسِنِينَ ﴿١١٥﴾

---

*Başqa bir quş gəlib onun işini bitirdi.*
*Pis bir iş gördünsə, bəlalardan qafil olma,*
*Təbiətdə mükafat vacibdir.*
*Bəlkə də dünya ədalətin aynasıdır ki,*
*Səndən nə görmüş olsa, onu əks etdirər.*

*Nəinki insanlar arasında, hətta heyvanlar arasında da pislik edənə cəza, yaxşılıq edənə mükafat verməyin vacibliyi dəlil və sübuta ehtiyacı olmayan bir qanunauyğunluqdur. Belə olan bir halda aləmlərin qüdrətli yaradıcısına zülm etməyin cəzasının necə ağır olacağını zalımların təsəvvür edib, özlərini zülm etməkdən saxlamaları lazım deyilmi? Lakin insanın nəfsinə tabe olmaqla özünü vəhşi heyvandan da əskik və alçaq bir mərtəbəyə salması son dərəcə təəccüblü bir işdir. Hidayətə qovuşduran Allahdır).*

(فَتَمَسَّكُمُ النَّارُ) **- o zaman cəhənnəmin odu sizə yetişib** (ondan nicat tapa bilməzsiniz)**.** (وَمَا لَكُمْ مِنْ دُونِ اللّٰهِ مِنْ اَوْلِيَٓاءَ) **- sizdən ötrü Allah-Təaladan başqa, dostlar və kömək olanlar yoxdur.** (ثُمَّ لَا تُنْصَرُونَ) **- ondan sonra Allah-Təala da sizə kömək etməyib və heç bir tərəfdən sizə kömək olmayıb** (həmişəlik əzabda qalarsınız)**.**

**114)** (وَاَقِمِ الصَّلٰوةَ طَرَفَيِ النَّهَارِ) **-** (bu ayə 5 vaxt namaz barəsindədir, buyurur: ey Məhəmməd)**, gündüzün hər iki tərəfində** (günortadan – zöhrdən əvvəl və sonra) **namaz qıl,** (ərəb zöhrdən qabaqkı vaxta "ğəda", sonrasına "işa" deyir. Ğəda sübh namazıdır, sonra zöhr, əsr, işa namazları gəlir)**,** (وَزُلَفًا مِنَ الَّيْلِ) **– və gecənin əvvəlindən bir az keçənə qədər** (namaz qıl, gecənin bu vaxtında olan namaz məğrib (işa) namazıdır)**.** (اِنَّ الْحَسَنَاتِ يُذْهِبْنَ السَّيِّـَٔاتِ) **- həqiqətən, yaxşılıq** (5 vaxt gözəl namaz insanın) **kiçik günahlarını aparıb** (ondan ötrü kəffarə olar)**.** (Amma böyük günaha ancaq tövbə lazımdır)**.** (ذٰلِكَ ذِكْرٰى لِلذَّاكِرِينَ) **- bu** (sözlər) **öyüd-nəsihət qəbul edənlərdən ötrü bir vəzdir.** (Allah-Təalanın sözlərindən yaxşı və gözəl vəz olmaz, amma eşidən qulaq və yadda saxlayan qəlb hanı?)

**115)** (وَاصْبِرْ) **–** (bu nəsihətlərin hamısından əhəmiyyətlisi və zərurisi səbirdir. Ey Məhəmməd, əmr olunan şeyləri edib, qadağan olunan şeyləri tərk etməkdə) **səbir et.** (فَاِنَّ اللّٰهَ لَا يُضِيعُ اَجْرَ الْمُحْسِنِينَ) **- həqiqətən, Allah-Təala yaxşı əməl sahiblərinin əcrlərini zay etməz.** (Keçən ayələrdə deyildiyi kimi, Allah-Təalanın əmr və qadağalarına düz riayət edən, 5 vaxt namaz qılıb, tüğyan etməyən, zalıma meyil etməyi tərk edib səbir edənlər yaxşı əməl sahibləridir)**.**

فَلَوْلَا كَانَ مِنَ الْقُرُونِ مِنْ قَبْلِكُمْ اُولُوا بَقِيَّةٍ يَنْهَوْنَ عَنِ الْفَسَادِ فِي الْاَرْضِ اِلَّا قَلِيلًا مِمَّنْ اَنْجَيْنَا
مِنْهُمْ وَاتَّبَعَ الَّذِينَ ظَلَمُوا مَٓا اُتْرِفُوا فِيهِ وَكَانُوا مُجْرِمِينَ ﴿١١٦﴾ وَمَا كَانَ رَبُّكَ لِيُهْلِكَ الْقُرٰى بِظُلْمٍ
وَاَهْلُهَا مُصْلِحُونَ ﴿١١٧﴾ وَلَوْ شَٓاءَ رَبُّكَ لَجَعَلَ النَّاسَ اُمَّةً وَاحِدَةً وَلَا يَزَالُونَ مُخْتَلِفِينَ ﴿١١٨﴾
اِلَّا مَنْ رَحِمَ رَبُّكَ وَلِذٰلِكَ خَلَقَهُمْ وَتَمَّتْ كَلِمَةُ رَبِّكَ

---

**116)** (فَلَوْلَا كَانَ مِنَ الْقُرُونِ مِنْ قَبْلِكُمْ اُولُوا بَقِيَّةٍ) - (ey Məhəmməd ümməti)**, niyə sizdən əvvəlki dövrlərdə xeyir, fəzilət sahibi,** (Allah-Təaladan qorxan) **şəxslər olmadı?** (يَنْهَوْنَ عَنِ الْفَسَادِ فِي الْاَرْضِ) **- gərək, belə şəxslər olub yer üzündə fəsad törətməyi xalqa qadağan edəydilər.** (Amma belə şəxslər olmadılar. O səbəbdən biz də onları həlak etdik)**.** (اِلَّا قَلِيلًا مِمَّنْ اَنْجَيْنَا مِنْهُمْ) **- ancaq** (həlak olan) **camaatların arasından çox az şəxsə nicat verdik.** (Çünki onlar xalqa nəsihət edib fəsad törətməyi qadağan edirdilər)**.** (وَاتَّبَعَ الَّذِينَ ظَلَمُوا مَٓا اُتْرِفُوا فِيهِ) **– zalımlar isə adət etdikləri** (və ləzzət aldıqları) **o nemətlərə tabe olub,** (onlarla məşğul olub Allah-Təalanı unudub, dinin əsli olan xeyri əmr, şəri qadağan etməyi tərk edib, Allah-Təalaya asi olduqları üçün həlak oldular)**.** (وَكَانُوا مُجْرِمِينَ) **–** (küfrlərində son dərəcə şiddətli, Allah-Təalaya asi və) **günahkar idilər.** (Ey islam ümməti, sizdən əvvəlki ümmətlər kimi olmayın, gərək, sizdə də xeyri əmr, şəri qadağan edənlər olsun, onlar xalqın yer üzündə fəsad törətməsinə mane olsunlar. Bizdə islamın ancaq quru adı qalıb. İlahi, bir nəzər eylə, sən özün agahsan ki, islam ümməti şəriəti tərk edib nəfsani arzulara tabe olduğuna görə özgə millətlərə tabe olublar, az qalıblar ki, darmadağın olsunlar)**.**

**117)** (وَمَا كَانَ رَبُّكَ لِيُهْلِكَ الْقُرٰى بِظُلْمٍ) **-** (ey Məhəmməd)**, rəbbin Allah-Təalanın hikmətinə uyğun deyil** (elə bir hökmü yoxdur) **ki, bir məmləkətin əhalisinə zülm edib,** (səbəbsiz yerə onları həlak etsin)**.** (وَاَهْلُهَا مُصْلِحُونَ) **- bir halda ki, o məmləkətin əhalisi də islahedici olub** (zalım, müşrik olmadıqca belə camaata Allah-Təala əzab göndərməz)**.**

**118-119)** (وَلَوْ شَٓاءَ رَبُّكَ لَجَعَلَ النَّاسَ اُمَّةً وَاحِدَةً) **-** (ey Məhəmməd)**, əgər sənin rəbbin Allah-Təala istəsə, bütün insanları tək bir ümmətə** (və bir dinə) **cəm edib** (hamısını islama daxil edərdi, amma insanları azad yaradıb, onlara ixtiyar verdiyindən onları zorla islama daxil etməz, gərək öz ixtiyarları ilə dinə daxil olsunlar)**.** (وَلَا يَزَالُونَ مُخْتَلِفِينَ اِلَّا مَنْ رَحِمَ رَبُّكَ) **- onlar həmişə ixtilafda olurlar, ancaq Allah-Təalanın rəhm edib** (haqqa meyil etdiklərinə görə, yardım və hidayət etdiyi) **şəxslər istisnadır.** (وَلِذٰلِكَ خَلَقَهُمْ) **– bunun üçün** (Allah-Təala insanı öz ixtiyarı ilə haqq dinə daxil olub, ya da olmamağa meyilli) **yaradıb,** (ona ixtiyar veribdir ki, haqqı seçənə savab, batili seçənə əzab versin. Bu aləm təklif aləmi olduğundan Allah-Təalanın hamını zorla bir dinə cəm etməsi doğru deyildir)**.** (وَتَمَّتْ كَلِمَةُ رَبِّكَ) **-** (ey Məhəmməd)**, sənin rəbbin Allah-Təalanın**

لَاَمْلَئَنَّ جَهَنَّمَ مِنَ الْجِنَّةِ وَالنَّاسِ اَجْمَعِينَ ﴿١١٩﴾ وَكُلًّا نَقُصُّ عَلَيْكَ مِنْ اَنْبَٓاءِ الرُّسُلِ مَا نُثَبِّتُ بِه۪
فُؤَادَكَۚ وَجَٓاءَكَ ف۪ي هٰذِهِ الْحَقُّ وَمَوْعِظَةٌ وَذِكْرٰى لِلْمُؤْمِن۪ينَ ﴿١٢٠﴾وَقُلْ لِلَّذ۪ينَ لَا يُؤْمِنُونَ اعْمَلُوا
عَلٰى مَكَانَتِكُمْۜ اِنَّا عَامِلُونَۙ ﴿١٢١﴾ وَانْتَظِرُواۚ اِنَّا مُنْتَظِرُونَ ﴿١٢٢﴾ وَلِلّٰهِ غَيْبُ السَّمٰوَاتِ وَالْاَرْضِ
وَاِلَيْهِ يُرْجَعُ الْاَمْرُ كُلُّهُ فَاعْبُدْهُ وَتَوَكَّلْ عَلَيْهِۜ وَمَا رَبُّكَ بِغَافِلٍ عَمَّا تَعْمَلُونَ ﴿١٢٣﴾

---

(asilər və kafirlər barəsindəki) **kəlməsi** (hökmü) **tamam oldu,** (لَاَمْلَئَنَّ جَهَنَّمَ مِنَ الْجِنَّةِ وَالنَّاسِ اَجْمَع۪ينَ) – (hansı ki)**, əlbəttə, cəhənnəmi** (asi və kafir) **cin və insanlarla tamam dolduracağam,** (demişdi)**.**

**120)** (وَكُلًّا نَقُصُّ عَلَيْكَ مِنْ اَنْبَٓاءِ الرُّسُلِ) (ey Məhəmməd)**, peyğəmbərlərin xəbərlərindən sənə nəql etdiklərimiz,** (مَا نُثَبِّتُ بِه۪ فُؤَادَكَ) – (elə xəbərlərdir ki, onların səbəbinə) **sənin** (qəlbini) **möhkəmləndirib,** (inancını artırırıq. Ta ki insanların əziyyətinə səbir edib onları hidayət etməkdə sabitqədəm olasan. Necə ki səndən qabaq keçən peyğəmbərlər olublar)**.** (وَجَٓاءَكَ ف۪ي هٰذِهِ الْحَقُّ) **-** (ey Məhəmməd)**, həmin bu surədə haqq** (olan sözlər - peyğəmbərlərin əhvalatı və onların qövmlərinə əzab nazil olması xəbəri) **sənə gəldi.** (وَمَوْعِظَةٌ وَذِكْرٰى لِلْمُؤْمِن۪ينَ) **-** (ey Məhəmməd, yenə bu surədə Allah-Təalaya iman gətirib səni və Quranı təsdiq edən) **möminlərdən ötrü öyüd-nəsihət gəldi.** (Gərək, o öyüd-nəsihətə tabe olub düz adam olsunlar)**.**

**121)** (وَقُلْ لِلَّذ۪ينَ لَا يُؤْمِنُونَ) **-** (ey Məhəmməd)**, Qurana iman gətirməyən şəxslərə de ki,** (اعْمَلُوا عَلٰى مَكَانَتِكُمْ) **–**(ey iman gətirməyənlər, küfrdə olduğunuz halda) **nə istəyirsiniz,** (nə bacarırsınızsa) **edin.** (اِنَّا عَامِلُونَ) **- həqiqətən, biz də öz əməlimizdəyik,** (Allah-Təalanın bizə əmr etdiklərini edərik)**.**

**122)** (وَانْتَظِرُوا اِنَّا مُنْتَظِرُونَ) **–** (Allah-Təalanın əzabını) **gözləyin. Həqiqətən, biz də** (sizinlə birlikdə) **gözləyirik** (ki, görək Allah-Təala sizinlə necə rəftar edəcəkdir?)

**123)** (وَلِلّٰهِ غَيْبُ السَّمٰوَاتِ وَالْاَرْضِ) **- səmaların və yerin** (xalqa) **qeyb və gizlin şeylərinə agah olmaq Allah-Təalaya məxsusdur.** (Heç bir gizlin şey Allah-Təalaya məxfi qalmaz)**.** (وَاِلَيْهِ يُرْجَعُ الْاَمْرُ كُلُّهُ) **- cəmi məxluqatın** (dünya və axirət) **bütün işləri Allah-Təalaya tərəf qayıdacaqdır.** (فَاعْبُدْهُ) **-** (ey Məhəmməd, belə bir məbuda ibadət etmək lazımdır)**, sən** (və sənə tabe olanlar belə) **Allah-Təalaya ibadət edin.** (وَتَوَكَّلْ عَلَيْهِ) **- hər bir işində Allah-Təalaya təvəkkül et.** (Tək Allah-Təala sənin hər bir işinə kifayət edər)**.** (وَمَا رَبُّكَ بِغَافِلٍ عَمَّا تَعْمَلُونَ) **–** (ey Məhəmməd,) **sənin rəbbin Allah-Təala** (sən və səndən başqa möminlərin və ya kafirlərin) **etdiyi heç bir əməldən qafil deyildir,** (cəmi məxluqatın əməllərini əhatə edib xəbərdar olandır)**.**

## *Hud surəsi*

Allaha həmd olsun. Hud surəsinin təfsiri bitdi, ağıl sahibi şəxslərdən ötrü nə böyük ibrət verən surədir. İbrət məqamında qeyd olunan qissələr, o qissələrin ehtiva etdiyi mənalar, rəmzlər, fəsahəti, bəlağəti ehtiva edən kəlam və kəlmələr bu surədə toplanıb, heç bir surədə belə fəsahət və bəlağətdə ayələr bəyan olunmayıb. Hərçənd Qurani-Şərifin bütün ayələri fəsahət və bəlağətdə elə bir dərəcədədir ki, bir nəfər də onların müqabilində bir surə, ya da bir ayə gətirə bilmə gücü yoxdur, amma ayələrin fəsahət və bəlağətdə bir-birilərindən fərqli olması ərəb dilində mahir olan həqiqi alimlərə gizli deyildir. Necə ki, şair deyir:

*Bəyan və fəsahətdə kimin sözü onunla bir ola bilər,*
*Danışan Cahiz və ya Əsməi kimi olsa belə.*
*Allah-Təalanın kəlamı ki, nazil olmuş vəhydir,*
*Kim deyə bilər "Təbbət yəda"* ("Əlləri qurusun" – 111-ci surə, 1-ci ayə)
*"Ya ərzə əbləi"* ("Ey yer, suyunu ud" – 11-ci surə, 44-cü ayə) (Laədri)

Hz. Peyğəmbər buyurubdur: "Hud surəsini kim oxusa, Allah-Təala ona 10 mükafat bəxş edər".




# YUSİF SURƏSİ

12-ci surədir. Məkkədə nazil olub, 111 ayə, 1600 kəlmə, 7166 hərfdir.

بِسْمِ اللّٰهِ الرَّحْمٰنِ الرَّحِيمِ. الۤرۚ تِلْكَ اٰيَاتُ الْكِتَابِ الْمُبِينِۜ ﴿١﴾ اِنَّٓا اَنْزَلْنَاهُ قُرْءٰنًا عَرَبِيًّا لَعَلَّكُمْ تَعْقِلُونَ ﴿٢﴾
نَحْنُ نَقُصُّ عَلَيْكَ اَحْسَنَ الْقَصَصِ بِمَٓا اَوْحَيْنَٓا اِلَيْكَ هٰذَا الْقُرْاٰنَۗ وَاِنْ كُنْتَ مِنْ قَبْلِه۪ لَمِنَ الْغَافِل۪ينَ ﴿٣﴾
اِذْ قَالَ يُوسُفُ لِاَب۪يهِ يَٓا اَبَتِ اِنّ۪ي رَاَيْتُ اَحَدَ عَشَرَ كَوْكَبًا وَالشَّمْسَ وَالْقَمَرَ رَاَيْتُهُمْ ل۪ي سَاجِد۪ينَ ﴿٤﴾

---

### Bismillahir-Rəhmanir-Rəhim

**1)** (الۤر) **- bu surə Əlif ləm ra surəsidir.** (تِلْكَ) **- bu** (surədə zikr olunan ayələr)**,** (اٰيَاتُ الْكِتَابِ الْمُب۪ينِ) **- möcüzə olduğu aşkar olan kitabın ayələridir.** (Kim bu kitab üzərində təfəkkür etmək istəsə, hər halda, onun möcüzə olması ondan ötrü aşkar olar. Yəhudilərin üləmaları müşriklərə dedilər: Məhəmməddən soruşun görək, səbəb nə oldu ki, Yaqub övladı Kənandan Misirə köçdü və bu Yusif Misirə necə daxil olubdur? Müşriklər gəlib Hz. Peyğəmbərə bu sualı verdilər, bu mübarək surə də nazil oldu)**.**

**2)** (اِنَّٓا اَنْزَلْنَاهُ قُرْءٰنًا عَرَبِيًّا لَعَلَّكُمْ تَعْقِلُونَ) **- həqiqətən, biz bu Quranı** (Hz. Məhəmməd ərəb olduğuna görə) **ərəb dilində nazil etdik ki,** (siz ərəblər ana diliniz ərəb dili olduğuna görə, onun mənasını) **dərk edib** (həqiqətini anlayasınız. Əgər başqa bir Quran göndərsəydik, hər halda, tənə vurub deyərdiniz ki, bu, əcəm dilidir, gərək ərəb dilində olaydı. İndi ki ərəb dilində nazil olub, yenə iman gətirmirsiniz)**.**

**3)** (نَحْنُ نَقُصُّ عَلَيْكَ اَحْسَنَ الْقَصَصِ بِمَٓا اَوْحَيْنَٓا اِلَيْكَ هٰذَا الْقُرْاٰنَ) - (ey Məhəmməd)**, bu Quranı sənə vəhy edib göndərməyimizə görə, qissələrin** (ən yaxşısını və) **ən gözəlini** (Yusif qissəsini) **səndən ötrü nəql edirik.** (وَاِنْ كُنْتَ مِنْ قَبْلِه۪ لَمِنَ الْغَافِل۪ينَ) **- həqiqətən,** (bu Quran sənə nazil olmadan) **əvvəl sən** (bu gözəl qissədən - Yusifin qissəsindən) **qafil olanlardan idin.** (Bundan sonra Allah-Təala Yusifin gözəl qissəsini bəyan etməyə başlayır)**.**

**4)** (اِذْ قَالَ يُوسُفُ لِاَب۪يهِ يَٓا اَبَتِ) - (ey Məhəmməd, Yusifin qissəsi belədir:)**. Elə ki Yusif atasına dedi: "Ey mənim atam,** (اِنّ۪ي رَاَيْتُ اَحَدَ عَشَرَ كَوْكَبًا وَالشَّمْسَ وَالْقَمَرَ) **- həqiqətən, mən yuxumda 11 ulduz, gün və ay gördüm."** (Yaqub dedi: oğlum, onları nə halda gördün?) **Yusif dedi:** (رَاَيْتُهُمْ ل۪ي سَاجِد۪ينَ) **- onları mənə səcdə edən halda gördüm.** (Yusif yuxunu iki yaşında gördü, 11 ulduz, bir gün, bir də ay onun 11 qardaşı, bir atası, bir də anasından ibarət idi. Yuxunun

قَالَ يَا بُنَيَّ لَا تَقْصُصْ رُءْيَاكَ عَلٰىٓ اِخْوَتِكَ فَيَكِيدُوا لَكَ كَيْدًاؕ اِنَّ الشَّيْطَانَ لِلْاِنْسَانِ عَدُوٌّ مُبِينٌ ﴿٥﴾
وَكَذٰلِكَ يَجْتَبِيكَ رَبُّكَ وَيُعَلِّمُكَ مِنْ تَأْوِيلِ الْاَحَادِيثِ وَيُتِمُّ نِعْمَتَهُ عَلَيْكَ وَعَلٰىٓ اٰلِ يَعْقُوبَ كَمَآ
اَتَمَّهَا عَلٰىٓ اَبَوَيْكَ مِنْ قَبْلُ اِبْرٰهِيمَ وَاِسْحٰقَؕ

---

yozumu 12 ildən sonra meydana gəldi. Yusifin ata-anası, qardaşları Misirdə onun hüzuruna gedib, onun Misir fironunun vəziri və baş hakimi olduğunu görüb ona səcdə etdilər. O vaxt da Yusif dedi: “Ey atam, mənim yuxumun yozumu budur.” İnşallah, surənin axırına yaxın qeyd olunacaqdır)**.**

**5)** (قَالَ يَا بُنَيَّ) – (Yaqub* Yusifin yuxusundan elm və hikmət sahibi və peyğəmbər olacağını anlayıb) **dedi: “Ey mənim oğulcuğazım,** (ata mərhəmətindən oğluna belə deyir)**,** (لَا تَقْصُصْ رُءْيَاكَ عَلٰىٓ اِخْوَتِكَ) **- yuxunu qardaşlarına xəbər vermə.** (فَيَكِيدُوا لَكَ كَيْدًا) – (əgər bu yuxunu qardaşlarına xəbər versən)**, hər halda, sənə məkr və hiylə edib** (səni qətl etməyə çalışarlar. Bu yuxu peyğəmbərlərə xas yuxudur. Qardaşların bu yuxundan sənin fəzilətini anlayıb, sənə zərər vermək istəyə bilərlər)**.** (اِنَّ الشَّيْطَانَ لِلْاِنْسَانِ عَدُوٌّ مُبِينٌ) **- həqiqətən, şeytan insanın açıq-aşkar düşmənidir,** (ola bilər ki, şeytan qardaşlarını yoldan çıxarıb, sənə zərər versinlər. Bu yuxunu qardaşlarına danışma)**.**

*(*Qeyd: Yaqub İshaqın oğlu, o da İbrahimin oğludur. Yaqubun iki arvadı, iki kənizdən 12 oğlu var idi. Arvadlarından birinin adı Liyah (Lea), o birisi Rahil (Rəhilə) idi, hər ikisi Yaqubun dayısı Labanın qızları və iki bacı idilər. İki bacını eyni vaxtda bir adamla evləndirmək Hz. İbrahimin şəriətində caiz olub, islam şəriətində bu hökm ləğv edildi. Liyahın Yaqubdan 4 oğlu var idi: 1. Rubin (Ruven), 2. Şəmun (Şimeon), 3. Leyun (Levi), 4. Yəhuda. Rahilin övladı olmadı. Bəlhah (Bilha) adlı kənizi Yaquba bağışladı. Dedi: “Kənizin övladı olsa, mənim övladım sayılar.” Bəlhah Yaqubdan iki oğul doğdu, 1. Dan, 2. Nəftali. Liyah baxdı, gördü, daha doğa bilmir, Zəlpah (Zilpa) adlı kənizini Yaquba bağışladı. Zəlpah Yaqubdan iki oğul doğdu, 1. Kad (Qad), 2.Əşir (Aşer), ondan sonra Liyah yenidən iki oğul doğdu. 1.Yəskar (İssakar), 2.Zəbulun (Zevul), ondan sonra bir qız doğdu, adı Diynah (Dina) idi. Rahil övladı olmadığı üçün ah-nalə edib Allah-Təalaya yalvardı. Allah-Təalanın yardımı ilə iki oğul doğdu, 1.Yusif, 2.Bünyamin. Yaqubun 12 oğlunun adları belədir).*

**6)** (وَكَذٰلِكَ يَجْتَبِيكَ رَبُّكَ) **-** (Yaqub deyir: “Ey Yusif, Allah-Təala səni yuxu yozumundan ötrü seçib şərəf və izzət sahibi edən kimi) **habelə səni** (böyük işlərdən ötrü) **seçib (başqalarına) üstün edəcək.** (وَيُعَلِّمُكَ مِنْ تَأْوِيلِ الْاَحَادِيثِ) – (ey Yusif, Allah-Təala özünün və peyğəmbərlərinin müşkül) **sözlərinin yozumunu** (və hikmətini) **sənə öyrədəcək.** (وَيُتِمُّ نِعْمَتَهُ عَلَيْكَ وَعَلٰىٓ اٰلِ يَعْقُوبَ) **- Allah-Təala sənə və övladlarıma olan nemətini tamamlayacaq.”** (Yaqubun bu sözü doğru oldu. Yusif dünya və axirət nemətinə sahib olub, hakimiyyətə və peyğəmbərliyə çatdı. Digər övladları da görkəmli şəxslər olub, içlərindən peyğəmbərlər və padşahlar da olmuşdur)**.** (كَمَآ اَتَمَّهَا عَلٰىٓ اَبَوَيْكَ مِنْ قَبْلُ اِبْرٰهِيمَ وَاِسْحٰقَ)

اِنَّ رَبَّكَ عَلٖيمٌ حَكٖيمٌ ﴿٦﴾ لَقَدْ كَانَ فٖي يُوسُفَ وَاِخْوَتِهٖٓ اٰيَاتٌ لِلسَّٓائِلٖينَ ﴿٧﴾ اِذْ قَالُوا لَيُوسُفُ
وَاَخُوهُ اَحَبُّ اِلٰٓى اَبٖينَا مِنَّا وَنَحْنُ عُصْبَةٌ اِنَّ اَبَانَا لَفٖي ضَلَالٍ مُبٖينٍ ﴿٨﴾ اُقْتُلُوا يُوسُفَ اَوِ اطْرَحُوهُ
اَرْضًا يَخْلُ لَكُمْ وَجْهُ اَبٖيكُمْ وَتَكُونُوا مِنْ بَعْدِهٖ قَوْمًا صَالِحٖينَ ﴿٩﴾ قَالَ قَٓائِلٌ مِنْهُمْ لَا تَقْتُلُوا يُوسُفَ
وَاَلْقُوهُ فٖي غَيَابَتِ الْجُبِّ يَلْتَقِطْهُ بَعْضُ السَّيَّارَةِ

---

– **necə ki** (Allah-Təala) **bundan qabaq babaların İbrahim və İshaqa olan nemətini tamamlayıb** (onları peyğəmbər etmişdi)**.** (اِنَّ رَبَّكَ عَلٖيمٌ حَكٖيمٌ) – (ey Yusif)**, həqiqətən, sənin rəbbin Allah-Təala** (xalqın arasından seçilməyə, peyğəmbərliyə layiq olan şəxsdən) **agahdır** (və layiq olana) **öz hikməti** (üzrə nemət verər. Yaqubun Yusifə dediyi sözlər bitdi)**.**

**7)** (لَقَدْ كَانَ فٖي يُوسُفَ وَاِخْوَتِهٖٓ اٰيَاتٌ لِلسَّٓائِلٖينَ) - (ey Məhəmməd)**, həqiqətən, soruşanlar üçün Yusifin və qardaşlarının əhvalatında Allah-Təalanın qüdrət və hikmətinə işarə edən dəlil və sübutlar var idi.** (Amma o dəlillərə tabe olmayıb şirklərində qaldılar. Bundan sonra Allah-Təala qissəni bəyan etməyə başlayır)**.**

**8)** (اِذْ قَالُوا لَيُوسُفُ وَاَخُوهُ اَحَبُّ اِلٰٓى اَبٖينَا مِنَّا) - **Yusifin qardaşları bir-birilərinə dedilər: "Əlbəttə, Yusif və onun** (anabir) **qardaşı** (Bünyamin) **atamızın yanında bizdən sevimlidirlər.** (Yusifi gözəlliyinə görə, Bünyamini də anası Rahilə olan məhəbbəti səbəbilə Yaqub digər oğullarından çox sevərdi. Bu mətləb qardaşlarına məlum olub onlara həsəd apardılar. Bu mətləb təkcə Yaqubun oğullarına məxsus deyildi, bəlkə, insan övladının əksərində belə həsəd olur)**.** (وَنَحْنُ عُصْبَةٌ) – (atamız Yusif və Bünyamini çox sevsə də, onlar uşaq olub, atamıza heç bir fayda vermirlər,) **halbuki biz qüvvətliyik,** (atamızı hər bir şiddət və bəladan qoruyan bizik, amma onlardan az sevilməmiz doğru deyil)**.** (اِنَّ اَبَانَا لَفٖي ضَلَالٍ مُبٖينٍ) - **həqiqətən, bizim atamız** (ədalətdən kənar)**, açıq-aşkar zəlalət içindədir.** (Ondan sonra Yusifin qardaşları bir-biriləri ilə məşvərət etdilər. Yusifi qətlə yetirib ondan xilas olmaq üçün işə başladılar. Necə ki Allah-Təala sıradakı ayədə xəbər verir)**.**

**9)** (اُقْتُلُوا يُوسُفَ اَوِ اطْرَحُوهُ اَرْضًا يَخْلُ لَكُمْ وَجْهُ اَبٖيكُمْ) – (bir-birilərinə dedilər:) **Yusifi öldürün, ya da onu** (qəsəbədən uzaq) **elə bir yerə atın ki, atanızın üzü** (sevgisi) **ancaq sizə məxsus olub,** (sizdən başqasını sevməsin)**.** (وَتَكُونُوا مِنْ بَعْدِهٖ قَوْمًا صَالِحٖينَ) – (Yusifin işini bitirəndən sonra atanız ancaq sizi sevəcəyindən) **dünyada möhtərəm və görkəmli bir camaat olarsınız.**

**10)** (قَالَ قَٓائِلٌ مِنْهُمْ) **- bir nəfər** (Yusifin qardaşlarından olub onu bir az istəyən Yəhuda) **onlara cavab verib dedi:** (لَا تَقْتُلُوا يُوسُفَ) **- "Yusifi öldürməyin.** (Adam öldürmək böyük günahdır). (وَاَلْقُوهُ فٖي غَيَابَتِ الْجُبِّ) **- bəlkə, aparıb onu bir quyunun içinə salın ki,** (يَلْتَقِطْهُ بَعْضُ السَّيَّارَةِ) **- yoldan gəlib gedənlərdən**

اِنْ كُنْتُمْ فَاعِلِينَ ﴿١٠﴾ قَالُوا يَٓا اَبَانَا مَا لَكَ لَا تَأْمَنَّا عَلٰى يُوسُفَ وَاِنَّا لَهُ لَنَاصِحُونَ ﴿١١﴾ اَرْسِلْهُ مَعَنَا غَدًا يَرْتَعْ وَيَلْعَبْ وَاِنَّا لَهُ لَحَافِظُونَ ﴿١٢﴾ قَالَ اِنّ۪ي لَيَحْزُنُن۪ٓي اَنْ تَذْهَبُوا بِه۪ وَاَخَافُ اَنْ يَأْكُلَهُ الذِّئْبُ وَاَنْتُمْ عَنْهُ غَافِلُونَ ﴿١٣﴾ قَالُوا لَئِنْ اَكَلَهُ الذِّئْبُ وَنَحْنُ عُصْبَةٌ اِنَّٓا اِذًا لَخَاسِرُونَ ﴿١٤﴾

---

**biri onu çıxarıb aparsın.** (اِنْ كُنْتُمْ فَاعِل۪ينَ) **- əgər belə edəcəksinizsə, edin.** (Yusifi atanızdan uzaqlaşdırmaq istəyirsinizsə, ən doğrusu budur. Bu yolla həm Yusifdən xilas olarsınız, həm də adam öldürməkdən qurtularsınız)**.”**

**11)** (قَالُوا يَٓا اَبَانَا مَا لَكَ لَا تَأْمَنَّا عَلٰى يُوسُفَ) **-** (Yusifi səhraya aparmaq üçün bir dəfə gəlib atalarından izin istədilər, Yaqub izin vermədi, ondan sonra gedib Yusifin özünü təşviq etdilər ki, çölə çıxıb səyahət etsin. Yusif razı olub atasından izin istəməkdə israr etdi. O vaxt da qardaşları yenidən atalarının yanına gəlib, Yusif üçün izin istədilər, necə ki ayədə xəbər verir)**, dedilər: “Ey bizim atamız, sənə nə olubdur ki, Yusif barəsində bizə xatircəm olmayıb, inanmayıb** (bizi əmin bilmirsən, yoxsa qorxursan ki, bizdən ona zərər gələr?) (وَاِنَّا لَهُ لَنَاصِحُونَ) **- həqiqətən, biz, əlbəttə, ona** (mehriban və) **nəsihət edənlərik.**

**12)** (اَرْسِلْهُ مَعَنَا غَدًا يَرْتَعْ وَيَلْعَبْ) **- sabahkı gün Yusifi bizimlə səhraya göndər,** (meyvə və başqa şeylərdən yeyib, at minib, səhrada) **səyahət edib qəlbi açılsın.** (وَاِنَّا لَهُ لَحَافِظُونَ) **- həqiqətən, biz onu, əlbəttə, hər bir əziyyət və azardan mühafizə edib,** (sənə salamat qaytararıq)**.”**

**13)** (قَالَ اِنّ۪ي لَيَحْزُنُن۪ي اَنْ تَذْهَبُوا بِه۪) – (Yaqub) **dedi: “**(ey oğullarım)**, sizin** (Yusifi) **götürüb getməyiniz məni məhzun və qəmgin edər.** (Çünki Yusifin ayrılığına səbir etməyə taqətim yoxdur. Yaqub Yusifin getməməsi üçün bir növ üzr istədi. Bir də sıradakı ayədə qeyd olunan ikinci üzrü budur:) (وَاَخَافُ اَنْ يَأْكُلَهُ الذِّئْبُ وَاَنْتُمْ عَنْهُ غَافِلُونَ) **- bir də mən bundan qorxuram ki,** (siz öz işinizə məşğul olub Yusifdən) **qafil olasınız. Onu da qurd yeyər.”** (o səhralarda qurd çox olduğundan Yaqub Yusifi aparmamaları üçün üzrxahlıq edib bəhanə gətirdi. Oğulları atalarının bu üzründən istifadə edib qayıdıb gələndən sonra dedilər ki, Yusifi qurd yeyib)**.**

**14)** (قَالُوا لَئِنْ اَكَلَهُ الذِّئْبُ وَنَحْنُ عُصْبَةٌ) **- dedilər: “Halbuki biz qüvvətli, şücaətli bir camaatıq, əgər Yusifi qurd yesə,** (اِنَّٓا اِذًا لَخَاسِرُونَ) **- həqiqətən, biz belə vaxtda özümüzə zərər verən olarıq,** (ta ki öz aramızda bir nəfəri qoruya bilməyək, onu qurd yesin. Elə ki Yaqubun oğulları Yusifi aparmaq üçün israr etdilər, Yusif də bir tərəfdən özü xahiş etdi, Yaqub naçar qalıb izin verdi. Oğulları son dərəcə şad oldular. Yusif özü hamısından çox şad oldu. O gecə ki səhərisi gedəcəkdilər, Yusifə uzun bir gecə kimi gəldi, amma Yaqubdan ötrü çox qısa gecə oldu. Yaqub o gecə Yusifin ayrılığı səbəbilə ah-nalə edib yuxusu gəlmədi. Sübh getməyə hazır oldular. Yusifin başını darayıb ona ətir vurub

فَلَمَّا ذَهَبُوا بِهٖ وَاَجْمَعُوٓا اَنْ يَجْعَلُوهُ فِي غَيَابَتِ الْجُبِّۚ وَاَوْحَيْنَآ اِلَيْهِ لَتُنَبِّئَنَّهُمْ بِاَمْرِهِمْ هٰذَا وَهُمْ لَا يَشْعُرُونَ ﴿١٥﴾

---

yaxşı libaslar geyindirdi. Babası İbrahim Xəlilullahın köynəyini göz muncuğu kimi gümüşdən bir qabın içində onun boynuna taxdı. Bir zənbildə ondan ötrü iki ədəd çörək, bir qədər zeytun, bir qədər süd və su qoyub Şəmuna tapşırdı. Dedi: "Yol əsnasında ola bilər ki, Yusif ac və susuz olsun, onun ac və susuz qalmağa taqəti yoxdur, ona süd və su verərsən." Yusif son dərəcə şad idi, atası onunla vidalaşıb, Yusifi sinəsinə basıb ağladı. Oğullarına dedi: "Məni məzəmmət etməyin, mən bu oğlum Yusifdə babam İbrahimin, atam İshaqın əlamətlərini görürəm. Bunun ayrılığına taqətim yoxdur." Yaqub bir günlük ayrılıq xəyalına görə, o hala düşmüşdü. Daha bilmirdi ki, illərlə Yusifin ayrılığına düçar olacaqdır. Nəhayət, izzət və ehtiramla Yusifi götürüb Yaqubun yanından ayrıldılar. Elə ki qəsəbədən ayrılıb, səhraya çıxdılar, ədavətlərini Yusifə bildirib, onu yerə yıxdılar, ona əziyyət edib vurmağa başladılar. Qardaşlarının hansına pənah aparsa, o da vurub əziyyət edirdi. Yusif gördü onu qətlə yetirmək fikrindədirlər. Başladı ağlayıb atasını çağırmağa: "Ey ata, gəl gör ki, oğulların Yusifə necə zülm və əziyyət edirlər." Son dərəcə şiddətlə ağladı. Qardaşlarının heç birisi ona rəhm etmədi. Rubin onu götürüb yerə yıxdı. İstədi qətlə yetirsin. Yusif dedi: "Qardaş, öldürmə məni." Rubin dedi: "Rahil oğlu, sən yuxu görənsən, qoy indi yuxular səni mühafizə etsin." Yusif Yəhudanı çağırdı, Yəhudanın qəlbinə rəhm düşüb dedi: "Qardaşlarım, mənimlə belə əhd etməmişdiniz, bizim əhdimiz bu idi ki, Yusifi quyuya salaq, indi gəlin onu quyuya salaq, ya quyuda özü həlak olar, ya da yoldan keçənlər onu götürüb apararlar. O vaxt da onun şərindən xilas olarıq." Onları bu mətləbə razı edib, Rubinin Yusifi qətlə yetirməsinə mane oldu. Yusifi götürüb quyunun üstünə gəldilər. İp götürüb Yusifi quyuya salmağa başladılar, Yusif quyunun kənarından yapışdı, ağlayıb, qardaşlarına yalvarıb-yaxarıb, nə qədər fəryad etsə də, qulaq asmadılar, onun əllərini quyunun kənarından itələyib, quyuya saldılar. Quyunun təkinə çatmamış ipi də kəsdilər ki, bəlkə, oradan quyunun dibinə düşüb həlak olsun. Quyunun içində su var idi. Yusif suyun içinə düşüb quyunun dibi dərin olmadığına görə, Yusif suyun içindən çıxıb quyunun bir tərəfində bir daşın üstündə oturdu. Yusifin quyuya salınmasını sıradakı ayə xəbər verir)**.**

**15)** (فَلَمَّا ذَهَبُوا بِهٖ) **– elə ki** (Yusifi aparıb səhrada quyunun üstünə) **yetişdilər,** (وَاَجْمَعُوٓا اَنْ يَجْعَلُوهُ فِي غَيَابَتِ الْجُبِّ) – (qardaşların) **hamısı** (Yusifi) **quyunun dibinə atmaq üçün toplandılar.** (وَاَوْحَيْنَآ اِلَيْهِ) – (Yusifi quyuya saldıqlarında)**, ona vəhy göndərib dedik:** (ey Yusif, sən bunlardan xilas olacaqsan)**,** (لَتُنَبِّئَنَّهُمْ بِاَمْرِهِمْ هٰذَا وَهُمْ لَا يَشْعُرُونَ) – (xilas olandan sonra qardaşların sənin hüzuruna gəlib) **səni**

وَجَآؤُ اَبَاهُمْ عِشَآءً يَبْكُونَ ﴿١٦﴾ قَالُوا يَا اَبَانَآ اِنَّا ذَهَبْنَا نَسْتَبِقُ وَتَرَكْنَا يُوسُفَ عِنْدَ مَتَاعِنَا فَاَكَلَهُ
الذِّئْبُ وَمَآ اَنْتَ بِمُؤْمِنٍ لَنَا وَلَوْ كُنَّا صَادِقِينَ ﴿١٧﴾ وَجَآؤُ عَلٰى قَمِيصِهِ بِدَمٍ كَذِبٍ قَالَ بَلْ سَوَّلَتْ
لَكُمْ اَنْفُسُكُمْ اَمْرًا

---

**tanımadıqları bir halda, etdikləri** (zülmlərini) **onlara xəbər verəcəksən.** (Belə də oldu, qardaşları Misirdə onun yanına gəldilər və onu səltənət işləri ilə məşğul görüb tanımadılar. Yusif elədiyi əməllərini onlara xəbər verdi. Onlar təəccüb etdilər. Bu mətləb təfsilatı ilə bundan sonra öz məqamında, inşallah, qeyd olunacaqdır. Yusifi quyuya salanda 10 qardaşı orada idi, bircə atabir-anabir qardaşı Bünyamin atasının yanında qalmışdı. Axşam zamanı olanda Yəhuda quyunun üstünə gəlib onu çağırdı: "Ey Yusif, dirisən, ya ölü?" Yusif dedi: "Sən kimsən?" Dedi: "Yəhudayam, halın necədir?" Yusif dedi: "Qardaşları tərəfindən zülmə məruz qalıb, atasından, vətənindən ayrı düşən, quyunun dibində ac və qəmgin qalan, nə yer üzündəki dirilər kimi diri, nə də yer altındakı ölülər kimi ölü olan adamın halı necə olar?" Ondan sonra Yusif şiddətlə ağlayıb Yəhudanı da ağlatdı. Ondan sonra Yusif dedi: "Ey Yəhuda, hər bir ölənin bir vəsiyyəti olur. Mənim sənə vəsiyyətim budur, nə vaxt bir cavana baxdın, mənim cavanlığımı yadına sal. Harada yetim, ya da qərib gördün, mənim qərib olmağımı yadına sal. Qardaşlarımın mənə elədiyi zülmü atama xəbər vermə." Yəhuda şiddətlə ağladı. Qardaşları onun ağlamasını eşidib gəldilər. Onu məzəmmət edib quyunun üstünə bir daş qoydular. Yusif o vaxt 12 yaşında idi. 3 gün quyuda qaldı. O 3 gündə Yəhuda qardaşlarından gizli ona yemək gətirirdi. Ondan sonra bir keçi balasını kəsib, onun qanıyla Yusifin əynindən çıxartdıqları köynəyini buladılar, bir neçə yerdən o köynəyi parça-parça etdilər, guya Yusifi qurd yeyəndə köynəyi parçalanıbdır. Gecə vaxtı ağlaya-ağlaya atalarının yanına gəldilər. Necə ki sıradakı ayədə xəbər verir)**.**

**16)** (وَجَآؤُ اَبَاهُمْ عِشَآءً يَبْكُونَ) **- çöldən qayıdıb atalarının yanına gecə vaxtı ağlayaraq gəldilər.** (Yaqub Yusifi onlarla görməyib, oğullarını da ağlayan görəndə dəhşətə gəlib dedi: "Sizə nə oldu? Hanı Yusif, mənim oğlum Yusif necə oldu?")

**17)** (قَالُوا يَا اَبَانَآ اِنَّا ذَهَبْنَا نَسْتَبِقُ) **- dedilər: "Ey bizim atamız, biz bir-birimizlə at qovmağa çıxıb** (Yusifdən uzaqlaşdıq)**.** (وَتَرَكْنَا يُوسُفَ عِنْدَ مَتَاعِنَا) - (uşaq olduğu üçün) **Yusifi libasımızın** (əşyalarımızın) **yanında qoyduq.** (فَاَكَلَهُ الذِّئْبُ) – (biz Yusifdən uzaqlaşanda) **qurd** (gəlib) **onu yeyibdir.** (وَمَآ اَنْتَ بِمُؤْمِنٍ لَنَا) – **amma sən bizə inanıb,** (təsdiq edib sözümüzü qəbul edən deyilsən)**.** (وَلَوْ كُنَّا صَادِقِينَ) – **hərçənd biz sözümüzdə doğru olsaq da."**

**18)** (وَجَآؤُ عَلٰى قَمِيصِهِ بِدَمٍ كَذِبٍ) **- öz sözlərinin doğru olması haqqında Yusifin köynəyini yalan qanla** (şahid) **gətirdilər.** (قَالَ بَلْ سَوَّلَتْ لَكُمْ اَنْفُسُكُمْ اَمْرًا) –

فَصَبْرٌ جَمِيلٌ وَاللّٰهُ الْمُسْتَعَانُ عَلٰى مَا تَصِفُونَ ﴿١٨﴾ وَجَاۤءَتْ سَيَّارَةٌ فَاَرْسَلُوا وَارِدَهُمْ فَاَدْلٰى دَلْوَهُ
قَالَ يَا بُشْرٰى هٰذَا غُلَامٌ وَاَسَرُّوهُ بِضَاعَةً وَاللّٰهُ عَلِيمٌ بِمَا يَعْمَلُونَ ﴿١٩﴾ وَشَرَوْهُ بِثَمَنٍ بَخْسٍ دَرَاهِمَ
مَعْدُودَةٍ وَكَانُوا فِيهِ مِنَ الزَّاهِدِينَ ﴿٢٠﴾

---

(Yaqub) **dedi: "**(Sizin dediyiniz kimi deyil, mənim oğlumu qurd yeməyibdir)**. Bəlkə, sizin nəfsiniz sizdən ötrü bir işi** (Yusifi qətl etməyi gözəl və asan) **göstərib** (siz də o işi edibsiniz)**.** (فَصَبْرٌ جَمِيلٌ) – (indi bundan sonra mənim işim) **gözəl səbir etməkdir,** (heç vaxt xalqa şikayət etmərəm)**.** (وَاللّٰهُ الْمُسْتَعَانُ عَلٰى مَا تَصِفُونَ) **-** (Yusif barəsində) **dediyiniz sözə görə, Allah-Təaladan kömək** (istəyib səbir edirəm)"**.** (Yusif 3 gün quyuda qaldı, 3 gündən sonra Allah-Təala ona nicat verdi. Mədyəndən Misirə gedən bir karvan o quyuya yaxın gəlib dayandı. Necə ki sıradakı ayədə buyurur)**.**

**19)** (وَجَاۤءَتْ سَيَّارَةٌ) **- bir dəstə müsafir** (quyunun yanına) **gəlib** (dayandı)**.** (فَاَرْسَلُوا وَارِدَهُمْ) – (gəlib dayanandan sonra) **öz suçularını** (Malik* ibn Zuar adlı şəxsi) **göndərdilər** (ki, o quyudan onlara su gətirsin)**.** (فَاَدْلٰى دَلْوَهُ) **-** (Malik gəlib) **qabını** (quyuya) **saldı** (ki, su götürsün. Yusif qabı görüb qaba yapışdı. Malik gördü ki, qab ağırdır. Quyuya diqqətlə baxanda gördü ki, gözəl bir cavan qabdan yapışıbdır. Malik Yusifi görəndə yoldaşlarını çağırdı ki, köməyə gəlsinlər)**.** (قَالَ يَا بُشْرٰى هٰذَا غُلَامٌ) – (Malik) **dedi: "Müjdə** (olsun)**. Bu** (quyudakı gözəl) **bir oğlandır,** (gəlin kömək edin, bunu quyudan çıxaraq." Yusifi quyudan çıxarıb onun günəş kimi parlayan camalını görəndə çaşıb qaldılar. Yusifin qardaşları onları uzaqdan izləyirdilər. Bu mətləbdən xəbərdar olub onların yanına gəldilər. Dedilər: "Bu qulam sizdə haradandır?" Dedilər: "Quyudan çıxarmışıq." Dedilər: "Bu qulam bizimdir, qaçıb, neçə vaxtdır ki, axtarırıq." Dedilər: "Bu qulamı bizə satın." Xeyli danışıqdan sonra Yusifi 20 dirhəmə satdılar. Sonra da dedilər ki, bu qul qaçandır, diqqət edin ki, qaçmasın.Yusif öldürülmə qorxusundan heç danışmadı). (وَاَسَرُّوهُ بِضَاعَةً) – (qardaşları Yusifin həqiqi halını) **gizlədib** (onu özlərindən ötrü) **ticarət malı** (qulam) **etdilər.** (وَاللّٰهُ عَلِيمٌ بِمَا يَعْمَلُونَ) **- Allah-Təala onların etdiklərindən** (qardaşlarının Yusifi qətlə yetirmək istəməsindən) **agah idi.**

*(*Qeyd: Ola bilər ki, o şəxsin adı başqa cür olsun, amma ərəblər ona Malik ibn Zuar deyib).*

**20)** (وَشَرَوْهُ بِثَمَنٍ بَخْسٍ دَرَاهِمَ مَعْدُودَةٍ) **-** (Yusifi qardaşlarından) **az bir qiymətə bir neçə dirhəmə*** (20 dirhəmə) **satın aldılar.** (وَكَانُوا فِيهِ مِنَ الزَّاهِدِينَ) **- Yusifin qardaşları Yusifin qiymətini əskildənlərdən idi.** (Çünki onların məqsədi Yusufi atalarından uzaqlaşdırmaq idi, pulun məbləği deyildi. O səbəbdən məbləğə etina etməyib, onu 20 dirhəmə satdılar. Malik onu götürüb getdi, Misir yaxınlığında mübarək Nil çayının kənarında dayandılar. Malik Yusifə əmr

وَقَالَ الَّذي اشْتَرٰيهُ مِنْ مِصْرَ لِامْرَاَتِهٖٓ اَكْرِمي مَثْوٰيهُ عَسٰىٓ اَنْ يَنْفَعَنَآ اَوْ نَتَّخِذَهُ وَلَدًاۜ وَكَذٰلِكَ مَكَّنَّا لِيُوسُفَ فِي الْاَرْضِۘ وَلِنُعَلِّمَهُ مِنْ تَأْوِيلِ الْاَحَاديثِۜ وَاللّٰهُ غَالِبٌ عَلٰىٓ اَمْرِهٖ وَلٰكِنَّ اَكْثَرَ النَّاسِ لَا يَعْلَمُونَ ﴿٢١﴾

---

etdi ki, bədənini Nilin suyunda yu. Yusif Nildə bədənini yudu, Malik də ona yaxşı bir libas geyindirib yaxşı bir ata mindirdi. Misirə daxil oldular. O vaxt Misirin paytaxtı Menfis** idi. Misir əhli Yusifi görəndə onun mübarək camalına heyran qalıb dəstə-dəstə onun başına yığışdılar. Malik Yusifi satmaqdan ötrü bir gün təyin etdi, o gün qəribə izdiham oldu.

*(*__Qeyd:__ Dirhəmlər gümüş puldur. Hər birisi bir misqal (4, 65 qr.) ağırlığında idi, bəzi rəvayətlər də var ki, o dirhəmlər saxta idi).*

*(**__Qeyd:__ İskəndər Zülqərneyn İskəndəriyyəni tikdirəndən sonra Misirin paytaxtı gah Menfisdə, gah da İskəndəriyyədə olurdu. İslam zühur edəndən sonra II xəlifə Ömər ibn Xəttabın xəlifəliyi zamanında h. 18-ci ildə Əmr ibnül-Asın əliylə Misir fəth olundu. Nilin şərq tərəfində bir şəhər tikdirdi. Adını Fustat qoyub Misirin paytaxtı etdi. İndi Misirin qərbində olan Qahirə h. 400-cü ildə Fatimi xəlifələrindən əl-Muiz Lidinillahın əmriylə onun qulamı Qaid Cövhər tərəfindən tikdirilibdir. Fustat xarab olub, ondan ancaq Əmr ibnül-Asın tikdirdiyi məscidin bəzi izləri qalıbdır).*

Misir "əziz"inin (fironun vəzirinə ərəb dilində "əziz" deyilirdi) arvadı Rail (Züleyxa adıyla məşhurdur), Yusifi görüb bəyəndi. Misir fironunun vəziri Butayfır (Potifar; ərəbcə:Qıtfir) onu böyük məbləğə satın aldı. Tarixçi Vəhb ibn Münəbbih deyir: "Yusifi Misirdə satışa çıxaranda onun qiymətini o qədər artırdılar ki, qiyməti özü ağırlığında qızıl, gümüş, bir də mirvari oldu. Qıtfir bu şeyləri verib onu aldı. Aparıb öz evində ixtiyar sahibi etdi. Qıtfirin övladı olmadığından onu özünə övlad hesab edib Züleyxaya tapşırdı. Necə ki sıradakı ayədə xəbər verir)**.**

**21)** (وَقَالَ الَّذي اشْتَرٰيهُ مِنْ مِصْرَ لِامْرَاَتِهٖٓ) **- Misir əhlindən** (Yusifi) **alan** (Qıtfir) **arvadı** (Züleyxaya) **dedi:** (اَكْرِمي مَثْوٰيهُ) – **"**(Yusifi) **əziz və möhtərəm tutub onun** (libas və yeməyinə) **diqqət et.** (عَسٰىٓ اَنْ يَنْفَعَنَآ) **– ümid var ki,** (böyüyüb hər bir işə agah olub)**, bizə böyük mənfəət versin,** (اَوْ نَتَّخِذَهُ وَلَدًا) **– ya da** (övladımız olmadığından) **onu özümüzə övlad edək.** (وَكَذٰلِكَ مَكَّنَّا لِيُوسُفَ فِي الْاَرْضِ) **–** (ey Məhəmməd)**,** (Yusifə nicat verib, onu Misirin vəzirinə sevdirdiyimiz kimi qüdrət və ixtiyar da verib, Misir) **torpağında yerləşdirib** (hökm sahibi etdik)**.** (وَلِنُعَلِّمَهُ مِنْ تَأْوِيلِ الْاَحَاديثِ) – (Yusifə yozum) **elmini öyrətməkdən ötrü ona nicat verib Misirdə ixtiyar sahibi etdik.** (وَاللّٰهُ غَالِبٌ عَلٰىٓ اَمْرِهٖ) **- Allah-Təala öz əmrinə qalibdir.** (Nə istəsə, edər. Heç kim ona mane ola bilməz)**.** (وَلٰكِنَّ اَكْثَرَ النَّاسِ لَا يَعْلَمُونَ) **- lakin insanların çoxu bilmir** (ki, cəmi işlər Allah-Təalanın qüdrət əlindədir və bu səbəbdən ondan başqasına yönəlib yardım istəyirlər)**.**

**وَلَمَّا بَلَغَ اَشُدَّهُ اٰتَيْنَاهُ حُكْمًا وَعِلْمًاؕ وَكَذٰلِكَ نَجْزِي الْمُحْسِنِينَ ﴿٢٢﴾ وَرَاوَدَتْهُ الَّتِي هُوَ فِي بَيْتِهَا عَنْ نَفْسِهِ وَغَلَّقَتِ الْاَبْوَابَ وَقَالَتْ هَيْتَ لَكَۜ قَالَ مَعَاذَ اللّٰهِ اِنَّهُ رَبّ۪يٓ اَحْسَنَ مَثْوَايَۜ اِنَّهُ لَا يُفْلِحُ الظَّالِمُونَ ﴿٢٣﴾ وَلَقَدْ هَمَّتْ بِه۪ۚ وَهَمَّ بِهَاۚ لَوْلَٓا اَنْ رَاٰ بُرْهَانَ رَبِّه۪ۜ**

---

**22)** (وَلَمَّا بَلَغَ اَشُدَّهُ) **- Yusif yetkinlik** (və kamal məqamına - 18 yaşına) **çatdıqda,** (اٰتَيْنَاهُ حُكْمًا وَعِلْمًا) **- ona elm və hikmət verdik.** (وَكَذٰلِكَ نَجْزِي الْمُحْسِنِينَ) **- yaxşı əməl sahiblərinə belə mükafat veririk.**

**23)** (وَرَاوَدَتْهُ الَّتِي هُوَ فِي بَيْتِهَا عَنْ نَفْسِهِ) **– evində olduğu qadın** (Züleyxa Yusifi həyəcanlandırıb, özünə meyil etdirib) **ondan kam almaq üçün** (hiylə edib) **dəvət etdi.** (Züleyxanın Yusifə olan eşqi artdı, özünü saxlaya bilmədi. Neçə dəfə Yusifə bunu bildirsə də, Yusif ondan üz döndərdi. Axırda Züleyxa hiylə yolunu seçdi. Evi gözəl bəzəyib, özü də parlaq libaslar geyib zinət əşyaları ilə süsləndi. Belə halda evdə yalnız olarkən Yusifi çağırdı. Yusif gəlib onu o halda görəndə: "İlahi, mənə bu fitnədən nicat ver", -deyib çaşqınlıq içində qaldı. Züleyxa öz məqsədini Yusifə izhar etdi. Yusif rədd etdi. O vaxt da Züleyxa qapıları bağladı. Necə ki sıradakı ayədə xəbər verir)**.** (وَغَلَّقَتِ الْاَبْوَابَ) **- Züleyxa qapıları bağladı** (ki, bəlkə zorla istədiyini Yusifdən alsın)**.** (وَقَالَتْ هَيْتَ لَكَ) – (qapıları bağlayandan sonra) **dedi: "**(ey Yusif, yanıma) **gəl,** (məni arzuma çatdır.)" (قَالَ مَعَاذَ اللّٰهِ) – (Yusif) **dedi: "**(məni dəvət etdiyin şeydən) **Allah-Təalaya pənah aparıb, ona sığınıram,** (necə ola bilər ki, mən ağam Qıtfirə xəyanət edib Allah-Təalaya asi olum?) (اِنَّهُ رَبّ۪يٓ اَحْسَنَ مَثْوَايَ) **- həqiqətən,** (Qıtfir) **mənim tərbiyə verənimdir.** (Mənə yaxşılıq edib, sənə də daha əvvəl demişdi ki, bunun haqqına riayət edib, ehtiramını saxla. Bu halda necə ola bilər ki, mən ona xəyanət edim?)" (اِنَّهُ لَا يُفْلِحُ الظَّالِمُونَ) **- həqiqətən,** (yaxşılığın əvəzinə pislik edib) **zalım olanlar nicat tapmazlar."**

**24)** (وَلَقَدْ هَمَّتْ بِه۪) **-** (Züleyxa gördü ki, Yusif öz istəyi ilə ona meyil edən deyildir. İstədi zorla onu bu qəbih əmələ vadar etsin. Necə ki Allah-Təala buyurur:) **həqiqətən,** (Züleyxa Yusifə) **meyil edib** (onu zorla bu qəbih əmələ vadar etmək istədi)**.** (وَهَمَّ بِهَا لَوْلَٓا اَنْ رَاٰ بُرْهَانَ رَبِّه۪) **- əgər** (Yusifin gözü* açıq olmayıb,

*(*Qeyd: Bu məqamda Əşəri məzhəbindən olan təfsirçilər bəzi sözlər yazıblar. Bu barədə nə qələmdə onu yazma gücü, nə də dildə onu təsdiq etmə gücü var. Allah-Təalanın peyğəmbəri Yusif ibn Yaquba (halbuki həmin surədə Allah-Təala onun ismətinə şəhadət edir) elə sözlər isnad ediblər ki, o sözləri heç həyasız, şərir, zinakar, sərxoş şəxsə isnad etmək olmaz. Təəccüblü olan odur ki, islam üləması əllərinə qələm alıb o sözləri səhifələrə yazmaqla qiyamətə qədər bizi xəcalətli ediblər. O sözlərdən kim xəbərdar olmaq istəsə, ərəb dilində olan təfsir kitablarına müraciət etsin. Mən həqir o sözlərdən birini də yazmağı böyük xəta hesab edirəm. Çox fikirləşəndən sonra Əşəri üləmalarının nəyə görə belə qəbih sözləri yazıb Hz. Yusifə isnad etməsini anladım.*

كَذٰلِكَ لِنَصْرِفَ عَنْهُ السُّوٓءَ وَالْفَحْشَآءَۜ اِنَّهُ مِنْ عِبَادِنَا الْمُخْلَصِينَ ﴿٢٤﴾

---

*Çünki bu məzhəbin (Əşəri məzhəbi) əhli Əbül-Həsən Əşəriyə tabe olub xeyir və şərin hər ikisini Allah-Təaladan bilib, özləri də gecələr sübhə kimi etdikləri hər bir qəbih əməli Allah-Təalaya isnad edib, özlərini iradəsiz sayırlar və bu səbəbdən nəinki Yusifə, hətta Allah-Təalanın bütün peyğəmbərlərinə qəbih əməllər isnad edib, onları da özləri kimi göstərirlər ki, həqiqət əhlinin məzəmmətindən xilas olsunlar. Peyğəmbərlərə belə qəbih əməlləri isnad etmələrinin səbəbi ancaq budur. Peyğəmbərlərdən ötrü ağıla və insafa sığmayan bəhanələr, üzrxahlıqlar da göstərirlər. Bu ayədə Hz. Yusifə qəbih əməlləri isnad etsələr də, ayənin əvvəlindəki kəlmədən qafil olublar, hansı ki, Allah-Təala Yusif və Züleyxanın dili ilə belə xəbər verir: (Züleyxa) dedi (ki, yanıma) gəl ey Yusif, (Yusif) dedi: bu qəbih olan əməldən Allah-Təalaya pənah aparıram. Yusifin bu məsumluğunu unudub, "həqiqətən, (Züleyxa Yusifə) meyil edib..." ayəsinə əsasən ağıldan kənar qəbih əməlləri o cənaba isnad etməkdən ar etmirlər. Habelə bu ayənin arxasınca gələn ayədə buyurur: "Cəmi qəbih əməlləri Yusifdən sovuşdurmuşuq, o, bizim ixlaslı bəndələrimizdəndir". Bu ayələrə heç etina etməyib öz məqsədləri naminə peyğəmbərləri də asi və qüsurlu kimi göstərirlər. Vay müsəlmanların halına, Qurani-Şərifi necə də təhrif edirlər).*

öz rəbbi Allah-Təalanın haramdan çəkinməkdən ötrü olan dəlil və sübutunu) **görməsəydi,** (Züleyxaya) **meyil edərdi.** (Amma gözüaçıq olub dəlil və sübut üzrə haramın qəbahətini dərk etdiyindən bu qəbih əməli tərk etdi)**.** (كَذٰلِكَ) **- habelə** (Yusifi də Allah-Təalanın əmrində və Züleyxanı tərk etməkdə sabitqədəm etdik)**.** (لِنَصْرِفَ عَنْهُ السُّوٓءَ وَالْفَحْشَآءَ) **- ta ki,** (xəyanət edib zina etmək xəyanətini) **ondan sovuşduraq.** (اِنَّهُ مِنْ عِبَادِنَا الْمُخْلَصِينَ) **- həqiqətən,** (Yusif itaət və ibadətdə) **bizim ixlaslı bəndələrimizdəndir.** (Züleyxa Yusifi evə salıb qapıları bağlayıb, lakin yenə öz məqsədinə çatmadıqda, Yusiflə eşq və məhəbbətdən danışmağa başladı ki, bəlkə, onu həyəcanlandırıb öz arzusuna çata bilsin. Dedi: "Ey Yusif, nə gözəl surətin var." Yusif dedi: "Allah-Təala mənim bu surətimi ana rəhmi kimi murdar bir yerdə yaradıb, qəbirdə də torpaq onu yeyib məhv olacaqdır." Züleyxa dedi: "Ey Yusif, nə gözəl tüklərin var." Yusif dedi: "Qəbirdə mənim bədənimdən ilk aralanıb tökülən şey tük olacaqdır." Dedi: "Ey Yusif, nə gözəl, xoş ətrin var." Yusif dedi: "Əgər 3 gündən sonra qəbrimdə bədənimi görsən, hər halda onun üfunətli iyindən qaçarsan." Dedi: "Ey Yusif, nə yaxşı gözlərin var." Yusif dedi: "Bəli, bunlarla rəbbim Allah-Təalanın tövhidinə işarə edən dəlil və sübutlara baxıram. Lakin qəbirdə bədənimdən suya dönüb ilk axan şey mənim bu gözlərim olacaqdır." Dedi: "Ey Yusif, gözlərini qaldırıb mənə bir bax." Yusif dedi: "Qorxuram ki, ömrümün sonunda dünyada gözüm kor olub, axirətdə də kor kimi diriləm." Dedi: "Ey Yusif, niyə məndən kənar dayanırsan?" Yusif dedi: "Çünki Allah-Təalaya yaxın olmaq istəyirəm." Dedi: "Ey Yusif, libasını çıxarıb, mənimlə yatağa gir." Yusif dedi: "Nə yataq, nə də başqa bir şey məni Allah-Təaladan gizlədə

وَاسْتَبَقَا الْبَابَ وَقَدَّتْ قَمِيصَهُ مِنْ دُبُرٍ وَاَلْفَيَا سَيِّدَهَا لَدَا الْبَابِ قَالَتْ مَا جَزَآءُ مَنْ اَرَادَ بِاَهْلِكَ سُوٓءًا
اِلَّآ اَنْ يُسْجَنَ اَوْ عَذَابٌ اَلِيمٌ ﴿٢٥﴾ قَالَ هِيَ رَاوَدَتْنِي عَنْ نَفْسِي

---

bilməz.” Dedi: “Ey Yusif, ipək yorğan-döşək səndən ötrü hazırlanıb. Məni arzuma çatdır.” Yusif dedi: “O zaman cənnətdəki haqqımı itirərəm.” Dedi: “Ey Yusif, cürət edib, məni qəzəbləndirmə.” Yusif dedi: “Sənin qəzəbinlə öz rəbbimin rizasına ümidvar oluram.” Dedi: “Ey Yusif, sən mənim qulamımsan, səni mən almışam.” Yusif dedi: “Xəta və günah səbəbinə məni alıbsan.” Dedi: “Ey Yusif, kaş mən səni görüb, tanımayaydım.” Yusif dedi: “Bu mənim qardaşlarımın əməlidir, məni satdılar, gəlib bura düşdüm.” Dedi: “Ey Yusif, əlini sinəmə qoy, qəlbim aram olsun.” Yusif dedi: “Mənim odda yanmağa səbir və taqətim yoxdur.” Dedi: “Ey Yusif, səni aldım ki, özümdən ötrü ər edim.” Yusif dedi: “Mən başqasının yerində necə əkin əkərəm?” Dedi: “Ey Yusif, səni əzab edənlərin əlinə verərəm. Ta ki sənin bədənini əritsinlər. Necə ki sən mənim bədənimi əridirsən.” Yusif dedi: “Rəbbim məndən razı qalandan sonra əzabın bir qorxusu yoxdur. Dedi: “Ey Yusif, niyə məndən uzaq qaçırsan?” Yusif dedi: “İki haqqa görə, biri mənim rəbbim Allah-Təalanın haqqıdır, mənə belə əməlləri qadağan edib, o birisi mənim ağam Qıtfirin haqqıdır, ona xəyanət edə bilmərəm.” Züleyxa dedi: “Amma ağan qızıl kasanı əlinə alıb onu içəndə ağana zəhər verib onu həlak edərəm. Var-dövlətim, cəvahiratım çoxdur, səndən ötrü sədəqə verərəm, rəbbin də səni bağışlayar.” Yusif dedi: “Rəbbim rüşvət alan deyil.” Bu vaxt Züleyxa qəzəblənib əl atdı ki, Yusifi tutsun. Yusif də qapıya tərəf qaçdı. Züleyxa arxadan Yusifin köynəyini tutanda köynək parçalandı. Bu vaxt qapının qənşərində Qıtfir onlarla qarşılaşıb çaşıb-qaldı. Necə ki Allah-Təala bundan sonra gələn ayələrdə xəbər verir)**.**

**25)** (وَاسْتَبَقَا الْبَابَ وَقَدَّتْ قَمِيصَهُ مِنْ دُبُرٍ) **-** (Yusif və Züleyxanın ikisi də) **qapıya tərəf** (bir-birilərindən qabağa düşmək üçün) **cumdular.** (Yusif qaçıb xilas olmağa, Züleyxa ona mane olmağa cəhd etdi. Züleyxa) **arxadan** (Yusifin) **köynəyini tutub parçaladı.** (وَاَلْفَيَا سَيِّدَهَا لَدَا الْبَابِ) **- bu halda qapının yanında** (Züleyxanın sahibi) **əri** (Qıtfirlə) **rastlaşdılar.** (Züleyxa əri ilə bu şəkildə qarşılaşanda özünü təmizə çıxarıb Yusifi müqəssir etməkdən ötrü hiyləyə başladı)**.** (قَالَتْ مَا جَزَآءُ مَنْ اَرَادَ بِاَهْلِكَ سُوٓءًا اِلَّا اَنْ يُسْجَنَ اَوْ عَذَابٌ اَلِيمٌ) – (ərini qapının yanında görəndə tez-tələsik) **dedi: “Sənin ailənə pislik** (zina) **etmək istəyənin cəzası ya zindana salınmaq, ya da şiddətli əzab edilməkdən başqa şey ola bilməz.”**

**26)** (قَالَ هِيَ رَاوَدَتْنِي عَنْ نَفْسِي) **-** (Yusif baxıb gördü ki, töhmətə düçar olacaqdır, töhməti özündən dəf etməkdən ötrü) **dedi: “**(Züleyxa) **özü məndən kam almaq,** (qəbih əməl olan zina etmək) **istədi.** (Məndə ona qarşı pis bir istək olmayıb.” Bu vaxt Qıtfir çaşbaş qalıb sarayda onlardan ötrü bir şahid axtardı. (Züleyxanın qohumlarından biri bu mətləbdən xəbərdar olub, şahidlik etdi.

وَشَهِدَ شَاهِدٌ مِنْ اَهْلِهَاۚ اِنْ كَانَ قَمِيصُهُ قُدَّ مِنْ قُبُلٍ فَصَدَقَتْ وَهُوَ مِنَ الْكَاذِبِينَ ﴿٢٦﴾ وَاِنْ
كَانَ قَمِيصُهُ قُدَّ مِنْ دُبُرٍ فَكَذَبَتْ وَهُوَ مِنَ الصَّادِقِينَ ﴿٢٧﴾ فَلَمَّا رَاٰ قَمِيصَهُ قُدَّ مِنْ دُبُرٍ قَالَ اِنَّهُ
مِنْ كَيْدِكُنَّۜ اِنَّ كَيْدَكُنَّ عَظِيمٌ ﴿٢٨﴾ يُوسُفُ اَعْرِضْ عَنْ هٰذَا وَاسْتَغْفِرِي لِذَنْبِكِۚ اِنَّكِ كُنْتِ مِنَ
الْخَاطِئِينَ ﴿٢٩﴾ وَقَالَ نِسْوَةٌ فِي الْمَدِينَةِ امْرَاَتُ الْعَزِيزِ تُرَاوِدُ فَتٰيهَا عَنْ نَفْسِهِۚ قَدْ شَغَفَهَا حُبًّاۜ اِنَّا
لَنَرٰيهَا فِي ضَلَالٍ مُبِينٍ ﴿٣٠﴾

---

Hərçənd açıq-aşkar Züleyxanın əleyhinə şəhadət etməsə də, işarə ilə Züleyxanın təqsirini və Yusifin məsumluğunu göstərdi. Necə ki gələn ayədə buyurur)**.** (وَشَهِدَ شَاهِدٌ مِنْ اَهْلِهَا) – (Züleyxanın) **qohumlarından biri belə şəhadət etdi:** (اِنْ كَانَ قَمِيصُهُ قُدَّ مِنْ قُبُلٍ فَصَدَقَتْ وَهُوَ مِنَ الْكَاذِبِينَ) **- əgər** (Yusifin) **köynəyi qabaqdan cırılıbsa,** - (Züleyxa) **doğru deyir və** (Yusif) **yalançılardandır.**

**27)** (وَاِنْ كَانَ قَمِيصُهُ قُدَّ مِنْ دُبُرٍ) **- amma əgər** (Yusifin) **köynəyi arxadan yırtılmış isə,** (فَكَذَبَتْ وَهُوَ مِنَ الصَّادِقِينَ) – (Züleyxa) **yalan deyir, və** (Yusif) **doğru deyənlərdəndir.**

**28)** (فَلَمَّا رَاٰ قَمِيصَهُ قُدَّ مِنْ دُبُرٍ) – (bu şəhadətdən sonra Qıtfir Yusifin) **köynəyinə baxıb görəndə** (ki, Yusifin köynəyi arxadan yırtılıb, bildi ki, Züleyxa müqəssirdir)**,** (قَالَ اِنَّهُ مِنْ كَيْدِكُنَّ) **-** (Qıtfir) **dedi: "**(ey Züleyxa)**, bu sizin** (siz arvadların) **hiyləsindəndir.** (Burada Yusif müqəssir deyil)**.** (اِنَّ كَيْدَكُنَّ عَظِيمٌ) **- həqiqətən, sizin** (siz arvadların) **məkr və hiyləsi böyük olub,** (çox təsir edəndir)**.** (Ondan sonra Qıtfir Yusifə üz tutub bu məsələni unutmasını ona əmr etdi. Necə ki növbəti ayədə bunu xəbər verir)**.**

**29)** (يُوسُفُ اَعْرِضْ عَنْ هٰذَا) **- ey Yusif, sən bu işdən vaz keçib,** (heç kimə izhar etmə)**.** (وَاسْتَغْفِرِي لِذَنْبِكِ) - (ondan sonra Qıtfir Züleyxaya dönüb dedi:) – **"**(ey Züleyxa)**, sən də bu günahından ötrü tövbə et.** (اِنَّكِ كُنْتِ مِنَ الْخَاطِئِينَ) **- həqiqətən, sən günah edənlərdənsən.** (Sahibinə xəyanət edib Yusifə iftira edirsən. (Qıtfirin qeyrəti heyrətamizdir)**".**

**30)** (وَقَالَ نِسْوَةٌ فِي الْمَدِينَةِ امْرَاَتُ الْعَزِيزِ تُرَاوِدُ فَتٰيهَا عَنْ نَفْسِهِ) – (Misirdəki şəhərdə) **bir neçə qadın bu sözü yaydılar ki, vəzirin** (Qıtfirin) **arvadı bir cavanla** (qulamı Yusiflə) **yaxınlaşmaq istəyib.** (قَدْ شَغَفَهَا حُبًّا) – (qulamın) **məhəbbəti bağrını yarıb** (onu dəli edibdir)**.** (اِنَّا لَنَرٰيهَا فِي ضَلَالٍ مُبِينٍ) **- həqiqətən, biz** (Züleyxanı) **açıq-aşkar bir xətada görürük,** (çünki o, şan və məqama baxmayaraq öz iffət və ismətini tərk edib qulamla eşqbazlığa başlayıbdır. Bu sözü Misirdə camaat içində yayan bu 5 qadın idi: 1-padşahın saqisinin 2-qapıçısının 3-aşbazının 4-baş mehtərinin 5- türmə rəisinin arvadları. Bu söz yayılıb Züleyxaya da çatdı. Züleyxa Yusifin xariqüladə gözəlliyini onlara göstərib, onların da Yusifə heyran olmalarını istədi. Onları qonaqlığa dəvət etdi. Necə ki sırada-

فَلَمَّا سَمِعَتْ بِمَكْرِهِنَّ اَرْسَلَتْ اِلَيْهِنَّ وَاَعْتَدَتْ لَهُنَّ مُتَّكَـًٔا وَاٰتَتْ كُلَّ وَاحِدَةٍ مِنْهُنَّ سِكّٖينًا وَقَالَتِ
اخْرُجْ عَلَيْهِنَّۚ فَلَمَّا رَاَيْنَهُ اَكْبَرْنَهُ وَقَطَّعْنَ اَيْدِيَهُنَّ وَقُلْنَ حَاشَ لِلّٰهِ مَا هٰذَا بَشَرًاؕ اِنْ هٰذَٓا اِلَّا مَلَكٌ كَرٖيمٌ
﴿٣١﴾ قَالَتْ فَذٰلِكُنَّ الَّذٖي لُمْتُنَّنٖي فٖيهِؕ وَلَقَدْ رَاوَدْتُهُ عَنْ نَفْسِهٖ فَاسْتَعْصَمَؕ وَلَئِنْ لَمْ يَفْعَلْ مَٓا اٰمُرُهُ
لَيُسْجَنَنَّ وَلَيَكُونًا مِنَ الصَّاغِرٖينَ ﴿٣٢﴾

---

kı ayədə buyurur, ayədən belə məlum olur ki, onlar Yusifin gözəlliyini daha əvvəl görməmişdilər)**.**

**31)** (فَلَمَّا سَمِعَتْ بِمَكْرِهِنَّ اَرْسَلَتْ اِلَيْهِنَّ) – (Züleyxa qadınların məkr və hiyləsini və) **qeybətlərini,** (onu qınamalarını) **eşitdikdə, onları** (Misirin əsilzadələrindən olan 40 qadınla qonaqlığa) **dəvət etdi.** (وَاَعْتَدَتْ لَهُنَّ مُتَّكَـًٔا) **- onlardan ötrü gözəl** (döşənmiş) **bir məclis tərtib etdi.** (Elə ki gəlib məclisdə oturdular, onlardan ötrü hər növ meyvələrdən, yeməklərdən gətirdilər. Onların adəti yemək və meyvəni bıçaqla yemək idi)**.** (وَاٰتَتْ كُلَّ وَاحِدَةٍ مِنْهُنَّ سِكّٖينًا) – (qadınlardan) **hər birinin** (əlinə) **bir bıçaq verdi** (ki, yeməklə məşğul olsunlar. Qadınlar yemək yedikləri əsnada Züleyxa Yusifə gözəl libas geyindirib qadınlara xidmət etməsi üçün onların yanına getməsini əmr etdi. Yusif itaət edib məclisə daxil oldu, qadınlar onu qəfildən gördükdə hamısı cansız əşya kimi quruyub qaldılar)**.** (وَقَالَتِ اخْرُجْ عَلَيْهِنَّ) – (Züleyxa Yusifə) **dedi: “Get** (qadınların məclisinə) **daxil ol.”** (فَلَمَّا رَاَيْنَهُ اَكْبَرْنَهُ) – (qadınlar Yusifi) **gördükdə, onun** (gözəlliyinin) **böyüklüyünü anlayıb,** (çaşqınlıq içində özlərindən getdilər)**.** (وَقَطَّعْنَ اَيْدِيَهُنَّ) – (heyranlıqlarından bıçaqlarla) **əllərini kəsdilər.** (وَقُلْنَ حَاشَ لِلّٰهِ مَا هٰذَا بَشَرًا) **-** (Misirdə onun kimi bir gözəl görmədiklərindən) **dedilər: “Aman Tanrı!** (O, hər bir nöqsan və acizlikdən uzaq və pakdır. Tanrı belə gözəl insan yaratmaqdan aciz deyil, amma) **bu insan deyil.** (اِنْ هٰذَٓا اِلَّا مَلَكٌ كَرٖيمٌ) **-** (mələkləri ən gözəl varlıq saydıqlarından) **dedilər: “Bu ancaq** (Tanrı yanında) **əziz və hörmətli olan bir mələkdir.”** (İnsanda belə gözəlliyin olması imkansızdır)**.**

**32)** (قَالَتْ فَذٰلِكُنَّ الَّذٖي لُمْتُنَّنٖي فٖيهِ) **-** (Züleyxa qadınları o halda gördükdə özünü təmizə çıxarmaq üçün) **dedi: “Bu** (həmin qulamdır ki, ona olan eşqimə görə) **məni qınayırdınız.** (İndi bildiniz ki, mən haqlıyam və bu barədə üzürlüyəm)**.** (وَلَقَدْ رَاوَدْتُهُ عَنْ نَفْسِهٖ فَاسْتَعْصَمَ) **- həqiqətən, mən ondan kam almaq istədim, o isə özünü məndən qoruyub** (uzaq oldu)**.** (وَلَئِنْ لَمْ يَفْعَلْ مَٓا اٰمُرُهُ لَيُسْجَنَنَّ) – (sizin hüzurunuzda ona deyirəm, siz də şahid olun)**, əgər** (Yusif) **əmrimə əməl etməsə, əlbəttə, zindana salınacaqdır.** (وَلَيَكُونًا مِنَ الصَّاغِرٖينَ) **- və əlbəttə,** (orada əzaba düçar olan) **zəlillərdən olacaqdır.”** (Ondan sonra Züleyxa qadınlardan xahiş etdi ki, Yusifə nəsihət edin, bəlkə, mənə itaət etsin, məclisdəki qadınların hamısı Yusifə dedilər: “Ey Yusif, heyifsən, xanımına itaət edib özünü həlak etmə.” Ondan sonra birbəbir ayağa durub nəsihət bəhanəsiylə Yusifi xəlvətə

قَالَ رَبِّ السِّجْنُ اَحَبُّ اِلَيَّ مِمَّا يَدْعُونَنِي اِلَيْهِۚ وَاِلَّا تَصْرِفْ عَنِّي كَيْدَهُنَّ اَصْبُ اِلَيْهِنَّ وَاَكُنْ مِنَ
الْجَاهِلِينَ ﴿٣٣﴾ فَاسْتَجَابَ لَهُ رَبُّهُ فَصَرَفَ عَنْهُ كَيْدَهُنَّۜ اِنَّهُ هُوَ السَّمِيعُ الْعَلِيمُ ﴿٣٤﴾ ثُمَّ بَدَا لَهُمْ
مِنْ بَعْدِ مَا رَاَوُا الْاٰيَاتِ لَيَسْجُنُنَّهُ حَتّٰى حِينٍ ﴿٣٥﴾ وَدَخَلَ مَعَهُ السِّجْنَ فَتَيَانِۜ قَالَ اَحَدُهُمَٓا اِنّ۪ٓي
اَرٰين۪ٓي اَعْصِرُ خَمْرًاۚ

---

çəkib onu özləri ilə yaxınlığa dəvət etdilər. O vaxt da Yusifin taqəti kəsilib, çaşbaş qalıb Allah-Təalaya yönəldi).

**33)** (قَالَ رَبِّ السِّجْنُ اَحَبُّ اِلَيَّ مِمَّا يَدْعُونَنِي اِلَيْهِ) – (Yusif) **dedi: “Ey mənim rəbbim,** (bu qadınların) **məni dəvət etdiyi şeydənsə, zindanda olmaq mənə daha xoşdur.** (وَاِلَّا تَصْرِفْ عَنِّي كَيْدَهُنَّ) **- əgər** (bu qadınların) **məkr və şərini məndən dəf etməsən,** (اَصْبُ اِلَيْهِنَّ وَاَكُنْ مِنَ الْجَاهِلِينَ) **- o zaman onlara meyil edib cahillərdən olaram.”**

**34)** (فَاسْتَجَابَ لَهُ رَبُّهُ) – (Yusifin) **rəbbi Allah-Təala onun duasını qəbul edib,** (فَصَرَفَ عَنْهُ كَيْدَهُنَّ) – (qadınların) **məkr və şərini ondan dəf edib,** (onların dəvətindən qurtuldu). (اِنَّهُ هُوَ السَّمِيعُ الْعَلِيمُ) **- həqiqətən, Allah-Təala** (ona yönəlib çağıranların duasını) **eşidib** (onları necə islah edəcəyindən də) **agahdır.** (Züleyxa Yusifdən naümid olandan sonra düşündü ki, bəlkə, Yusifi zindana salmaqla onu özünə tabe etsin. Qıtfir hər barədə Züleyxaya itaət edib, onun ixtiyarı Züleyxanın əlində olduğundan Yusifin günahsızlığına işarə və şəhadət edənləri onun yadından çıxarıb, Qıtfiri Yusifi həbs etməyə vadar etdi. O da Züleyxaya tabe olub Yusifi həbs etdi. Necə ki sıradakı ayədə buyurur).

**35)** (ثُمَّ بَدَا لَهُمْ مِنْ بَعْدِ مَا رَاَوُا الْاٰيَاتِ لَيَسْجُنُنَّهُ حَتّٰى حِينٍ) **- ondan sonra** (Qıtfir və onun ailəsi) **belə qərara gəldilər ki,** (Yusifi) **müəyyən bir zamana kimi həbs etsinlər.** (Züleyxanın bu işdə məqsədi Yusifi özünə tabe etmək, Qıtfir və adamlarının məqsədi isə Züleyxanın bu işdə guya günahkar olmadığını camaata göstərmək idi).

**36)** (وَدَخَلَ مَعَهُ السِّجْنَ فَتَيَانِ) – (Yusifi həbsxanaya salanda) **onunla birlikdə** (fironun) **iki cavan qulamı da** (həbs edilib) **zindana daxil oldu,** (o iki nəfərin biri fironun saqisi, o birisi aşpazı idi. Bu iki şəxsi padşahın şərab və yeməyinə zəhər qatıb onu qətlə yetirmək qəsdiylə ittiham etdilər və bu səbəbdən padşah onları həbsə göndərdi. Yusif həbsə daxil olandan sonra məhbuslara öz elmini bildirib, onların yuxularını yozurdu. Fironun iki qulamı ya həqiqətən yuxu görmüşdülər, ya da Yusifi imtahan etməkdən ötrü bir-birilərinə dedilər: “Gəl özümüzdən bir yuxu düzəldib, bu yəhudi qulamı imtahan edək. Sonra Yusifin yanına gedib dedilər: biz bir yuxu görmüşük, bu yuxumuzu yoz.” Yusif buyurdu: “Yuxunuzu danışın”). (قَالَ اَحَدُهُمَٓا) **- o iki nəfərdən biri** (saqi) **dedi:** (اِنّ۪ٓي اَرٰينِي اَعْصِرُ خَمْرًا) **- “Həqiqətən, mən yuxuda** (özümü bir üzüm bağında görüb

وَقَالَ الْاٰخَرُ اِنّ۪ٓي اَرٰين۪ٓي اَحْمِلُ فَوْقَ رَأْس۪ي خُبْزًا تَأْكُلُ الطَّيْرُ مِنْهُۜ نَبِّئْنَا بِتَأْو۪يلِه۪ۚ اِنَّا نَرٰيكَ مِنَ الْمُحْسِن۪ينَ
﴿٣٦﴾ قَالَ لَا يَأْت۪يكُمَا طَعَامٌ تُرْزَقَانِه۪ٓ اِلَّا نَبَّأْتُكُمَا بِتَأْو۪يلِه۪ قَبْلَ اَنْ يَأْتِيَكُمَاۜ ذٰلِكُمَا مِمَّا عَلَّمَن۪ي رَبّ۪يۜ اِنّ۪ي
تَرَكْتُ مِلَّةَ قَوْمٍ لَا يُؤْمِنُونَ بِاللّٰهِ وَهُمْ بِالْاٰخِرَةِ هُمْ كَافِرُونَ ﴿٣٧﴾ وَاتَّبَعْتُ مِلَّةَ اٰبَٓاء۪ٓي اِبْرٰه۪يمَ وَاِسْحٰقَ
وَيَعْقُوبَۜ مَا كَانَ لَنَٓا اَنْ نُشْرِكَ بِاللّٰهِ مِنْ شَيْءٍۜ ذٰلِكَ مِنْ فَضْلِ اللّٰهِ عَلَيْنَا وَعَلَى النَّاسِ وَلٰكِنَّ اَكْثَرَ النَّاسِ
لَا يَشْكُرُونَ ﴿٣٨﴾ يَا صَاحِبَيِ السِّجْنِ ءَاَرْبَابٌ مُتَفَرِّقُونَ خَيْرٌ اَمِ اللّٰهُ الْوَاحِدُ الْقَهَّارُۜ ﴿٣٩﴾

---

3 salxım üzümü götürüb padşaha) **şərab** (hazırlamaq) **üçün sıxırdım."** (وَقَالَ الْاٰخَرُ اِنّ۪ٓي اَرٰين۪ي اَحْمِلُ فَوْقَ رَأْس۪ي خُبْزًا تَأْكُلُ الطَّيْرُ مِنْهُ) - **o birisi** (çörəkbişirən aşpaz) **dedi: "Mən də gördüm ki, başımın üstündə** (tabaqda) **çörək daşıyıram. Quşlar da** (o çörəyi) **yeyir.** (نَبِّئْنَا بِتَأْو۪يلِه۪) - **bizə bu yuxunun yozumunu xəbər ver.** (اِنَّا نَرٰيكَ مِنَ الْمُحْسِن۪ينَ) - **həqiqətən, biz səni yuxu yozumunda yaxşı** (alimlərdən olduğunu) **görürük.** (Yuxumuzu həqiqət üzrə yoz)**."**

**37)** (قَالَ لَا يَأْت۪يكُمَا طَعَامٌ تُرْزَقَانِه۪ٓ اِلَّا نَبَّأْتُكُمَا بِتَأْو۪يلِه۪ قَبْلَ اَنْ يَأْتِيَكُمَا)- (Yusif onların yuxusunu yozmadan peyğəmbərlik elmi haqqında onlara bilgi verdi. Ta ki yuxu yozumunun zənn və təxminə əsaslandığını güman edib, Yusifin də yuxu yozmasını zənn və təxmin hesab etməsinlər. Elə bilməsinlər ki, o yozum reallaşmayacaq, qoy bilsinlər ki, o yozum elm və yəqinlik üzrə olub, əlbəttə, vaqe olacaqdır, ayənin mənası belədir. Yusif) **dedi: "Ruziniz olan yemək** (evlərinizdən) **sizə gəlib çatmamış, onun həqiqətini** (yozumunu) **sizə xəbər verirəm.** (ذٰلِكُمَا مِمَّا عَلَّمَن۪ي رَبّ۪ي) – (sizə xəbər verdiyim bu elm) **rəbbim Allah-Təalanın mənə öyrətdiyi elmlərdəndir.** (اِنّ۪ي تَرَكْتُ مِلَّةَ قَوْمٍ لَا يُؤْمِنُونَ بِاللّٰهِ وَهُمْ بِالْاٰخِرَةِ هُمْ كَافِرُونَ) – (Allah-Təalanın bu elmi mənə öyrətməsinin səbəbi) **Allah-Təalaya iman gətirməyib axirəti inkar edən bir qövmün dinini tərk etməyimdir."**

**38)** (وَاتَّبَعْتُ مِلَّةَ اٰبَٓاء۪ٓي اِبْرٰه۪يمَ وَاِسْحٰقَ وَيَعْقُوبَ) – **ata-babalarım İbrahim, İshaq və Yaqubun dininə tabe olmuşam.** (مَا كَانَ لَنَٓا اَنْ نُشْرِكَ بِاللّٰهِ مِنْ شَيْءٍ) - **Allah-Təalaya şərik qoşmaq bizdən ötrü deyildir, heç vaxt nə özüm, nə də ata-babalarım Allah-Təalaya şərik qoşmamışıq.** (ذٰلِكَ مِنْ فَضْلِ اللّٰهِ عَلَيْنَا وَعَلَى النَّاسِ) – (bu tövhid) **biz** (peyğəmbərlərə və bizdən başqa sair) **insanlara Allah-Təalanın lütf və rəhmətidir,** (kim müvəhhid olsa, Allah-Təalanın rəhməti ona şamil olub nicat tapacaqdır)**.** (وَلٰكِنَّ اَكْثَرَ النَّاسِ لَا يَشْكُرُونَ) - **lakin insanların çoxu Allah-Təalanın bu lütf və rəhmətinə şükür etməyib,** (Allah-Təalaya şərik qoşurlar. Ayədə Hz. Yusif bütpərəstliyi onlara qadağan edib, sonra yuxularını yozmağa başlayır)**.**

**39)** (يَا صَاحِبَيِ السِّجْنِ) - **ey mənim iki zindan yoldaşım,** (ey saqi və aşpaz)**,** (ءَاَرْبَابٌ مُتَفَرِّقُونَ خَيْرٌ) – **bəs ayrı-ayrı olan** (daşdan, bürüncdən, dəmirdən, şüşədən böyük və kiçik) **məbudlara** (ibadət etmək) **yaxşıdır?** (اَمِ اللّٰهُ الْوَاحِدُ الْقَهَّارُ) - **yoxsa yeganə və qalib olan Allah-Təala,** (hansı ki hər şey ona tabe və məğlubdur, hansı yaxşıdır? Ondan sonra bütlərin acizliyini bəyan edib buyurur:)

مَا تَعْبُدُونَ مِنْ دُونِه۪ٓ اِلَّٓا اَسْمَٓاءً سَمَّيْتُمُوهَٓا اَنْتُمْ وَاٰبَٓاؤُ۬كُمْ مَٓا اَنْزَلَ اللّٰهُ بِهَا مِنْ سُلْطَانٍۜ اِنِ الْحُكْمُ اِلَّا لِلّٰهِۜ اَمَرَ اَلَّا تَعْبُدُوٓا اِلَّٓا اِيَّاهُۜ ذٰلِكَ الدّ۪ينُ الْقَيِّمُ وَلٰكِنَّ اَكْثَرَ النَّاسِ لَا يَعْلَمُونَ ﴿٤٠﴾ يَا صَاحِبَيِ السِّجْنِ اَمَّٓا اَحَدُكُمَا فَيَسْق۪ي رَبَّهُ خَمْرًاۚ وَاَمَّا الْاٰخَرُ فَيُصْلَبُ فَتَأْكُلُ الطَّيْرُ مِنْ رَأْسِه۪ۜ قُضِيَ الْاَمْرُ الَّذ۪ي ف۪يهِ تَسْتَفْتِيَانِۜ ﴿٤١﴾ وَقَالَ لِلَّذ۪ي ظَنَّ اَنَّهُ نَاجٍ مِنْهُمَا اذْكُرْن۪ي عِنْدَ رَبِّكَۘ فَاَنْسٰيهُ الشَّيْطَانُ ذِكْرَ رَبِّه۪ فَلَبِثَ فِي السِّجْنِ بِضْعَ سِن۪ينَۜ ﴿٤٢﴾

---

**40)** (مَا تَعْبُدُونَ مِنْ دُونِه۪ٓ اِلَّٓا اَسْمَٓاءً سَمَّيْتُمُوهَٓا اَنْتُمْ وَاٰبَٓاؤُ۬كُمْ)- **Allah-Təaladan qeyri ibadət etdikləriniz siz və ata-babalarınızın** (məbud) **adlandırdığı şeylərdən başqa bir şey deyil,** (siz, həqiqətən, boş yerə onlara ibadət edirsiniz. Çünki onların əsli yoxdur). (مَٓا اَنْزَلَ اللّٰهُ بِهَا مِنْ سُلْطَانٍ) - **onlara** (məbud adı qoymaq üçün) **Allah-Təala bir dəlil və höccət göndərməyibdir.** (Öz düzəltdiyiniz şeylərdir. Onlara necə ibadət etmək olar?) (اِنِ الْحُكْمُ اِلَّا لِلّٰهِ) – (din və ibadət işində) **hökm etmək ancaq Allah-Təalaya məxsusdur.** (Allah-Təalanın izin vermədiyi şeyə ibadət edilməz. Ondan sonra Allah-Təalanın əmrlərini bəyan edirəm). (اَمَرَ اَلَّا تَعْبُدُوٓا اِلَّٓا اِيَّاهُ) – (Allah-Təala) **əmr edib ki, gərək ancaq Onun özünə** (yeganə müqəddəs və "vacibül-vücud" (olmazsa olmaz) bir Zat olan Allah-Təalaya ibadət edəsiniz). (ذٰلِكَ الدّ۪ينُ الْقَيِّمُ) – (təkcə Ona ibadət edib şərik qoşmamaq həqiqi) **möhkəm olan dindir.** (وَلٰكِنَّ اَكْثَرَ النَّاسِ لَا يَعْلَمُونَ) - **lakin insanların çoxu ondan agah deyildir.** (Hz. Yusif Allah-Təalanın vəhdətini məhbuslara və yuxu yozumunu istəyənlərə bəyan edəndən sonra yuxunun yozumuna başlayır).

**41)** (يَا صَاحِبَيِ السِّجْنِ) - **ey mənim iki zindan yoldaşım,** (yuxunuzun yozumu belədir). (اَمَّٓا اَحَدُكُمَا) - **amma sizin biriniz** (yəni saqi) **3 gündən sonra zindandan xilas olar,** (فَيَسْق۪ي رَبَّهُ خَمْرًا) – (necə ki əvvəllər padşaha saqi idi)**, yenə padşaha** (saqi olub) **şərab içirər.** (وَاَمَّا الْاٰخَرُ) - **amma o biri** (yuxu görən - çörəkbişirən aşpaz) (فَيُصْلَبُ فَتَأْكُلُ الطَّيْرُ مِنْ رَأْسِه۪) - **üç gündən sonra onu** (zindandan çıxarıb) **asacaqlar, quşlar da onun başından yeyəcəklər."** (Onlar bu cavabı Yusifdən eşidəndə dedilər: "Biz yuxuda heç bir şey görməmişdik." Yusif onlara cavab verib dedi:) (قُضِيَ الْاَمْرُ الَّذ۪ي ف۪يهِ تَسْتَفْتِيَانِ) – **"soruşduğunuz işə** (Allah-Təala tərəfindən) **belə hökm olunmuşdur."** (Bu yuxunu görsəniz də, görməsəniz də, necə xəbər vermişəmsə, elə də olacaqdır).

**42)** (وَقَالَ لِلَّذ۪ي ظَنَّ اَنَّهُ نَاجٍ مِنْهُمَا) – (Yusif) **o iki nəfərdən nicat tapacağına inandığı şəxsə** (bu saqi özü inanmasa da) **belə dedi:** (اذْكُرْن۪ي عِنْدَ رَبِّكَ) - **"Məni öz sahibinin** (padşahın) **hüzurunda yad edib** (məndən ötrü şəfaət et. De ki, bir yəhudi qulamı neçə vaxtdır ki, məhbusdur, mənim qissəmi ona bəyan elə." 3 gündən sonra onları zindandan çıxarıb, saqini öz mənsəbinə qaytarıb, aşpazı da asdılar). (فَاَنْسٰيهُ الشَّيْطَانُ ذِكْرَ رَبِّه۪) – (saqi zindandan çıxandan sonra) **şeytan padşahın yanında onun** (Yusifi) **xatırlamasını unutdurub** (Yusif zindanda qaldı). (فَلَبِثَ فِي السِّجْنِ بِضْعَ سِن۪ينَ) – (Yusif) **zindanda bir neçə il** (3 - 9 il arası) **qaldı.** (Yusifin bu qədər zindanda qalmasının səbəbkarı Züleyxa idi. Hər dəfə

وَقَالَ الْمَلِكُ اِنِّيٓ اَرٰى سَبْعَ بَقَرَاتٍ سِمَانٍ يَأْكُلُهُنَّ سَبْعٌ عِجَافٌ وَسَبْعَ سُنْبُلَاتٍ خُضْرٍ وَاُخَرَ يَابِسَاتٍۜ
يَآ اَيُّهَا الْمَلَاُ اَفْتُونِي فِي رُءْيَايَ اِنْ كُنْتُمْ لِلرُّءْيَا تَعْبُرُونَ ﴿٤٣﴾ قَالُوٓا اَضْغَاثُ اَحْلَامٍۚ وَمَا نَحْنُ بِتَأْوِيلِ
الْاَحْلَامِ بِعَالِمِينَ ﴿٤٤﴾ وَقَالَ الَّذِي نَجَا مِنْهُمَا وَادَّكَرَ بَعْدَ اُمَّةٍ اَنَا اُنَبِّئُكُمْ بِتَأْوِيلِهِ فَاَرْسِلُونِ ﴿٤٥﴾
يُوسُفُ اَيُّهَا الصِّدِّيقُ اَفْتِنَا فِي سَبْعِ بَقَرَاتٍ سِمَانٍ يَأْكُلُهُنَّ سَبْعٌ عِجَافٌ وَسَبْعِ سُنْبُلَاتٍ خُضْرٍ وَاُخَرَ
يَابِسَاتٍۙ لَعَلِّيٓ اَرْجِعُ اِلَى النَّاسِ لَعَلَّهُمْ يَعْلَمُونَ ﴿٤٦﴾

---

zindanda belə Yusifdən öz arzusunu istədikdə, Yusif rədd edib, zindanda qalmasına səbəb olmuşdu. Əgər Allah-Təala istəməsəydi, padşah yuxu görməz, Yusif də zindanda qalıb məhv olardı. Bir gecə firon yuxuda gördü ki, 7 kök öküz və 7 arıq öküz çaydan çıxdılar. O 7 arıq öküz 7 kök öküzü uddu. Ondan sonra 7 təzə yaşıl sünbül və 7 quru sünbül gördü. O yeddi quru sünbül yeddi təzə sünbülə sarmaşıb onlara qalib olub onları da qurudub məhv etdi. Bu yuxunu görüb şiddətli iztirabla yuxudan oyandı. Üləma və yuxu yozanları çağırıb onlardan cavab istədi, necə ki gələn ayədə Allah-Təala xəbər verir)**.**

**43)** (وَقَالَ الْمَلِكُ اِنِّيٓ اَرٰى سَبْعَ بَقَرَاتٍ سِمَانٍ) – **padşah** (üləma və yuxu yozanları çağırıb) **dedi: “Mən** (yuxuda) **7 kök öküz gördüm.** (يَأْكُلُهُنَّ سَبْعٌ عِجَافٌ) **- və 7 arıq öküz** (də gördüm ki, o kök öküzləri) **yedilər.** (Amma arıqlarda heç bir kökəlmə görülmədi)**.** (وَسَبْعَ سُنْبُلَاتٍ خُضْرٍ وَاُخَرَ يَابِسَاتٍ) – (yenə yuxuda) **7 ədəd** (təzə) **yaşıl və 7 ədəd quru sünbül** (gördüm. O quru sünbüllər yaşıl sünbüllərə sarmaşıb onlara qalib olub məhv və yox etdilər)**.** (يَآ اَيُّهَا الْمَلَاُ اَفْتُونِي فِي رُءْيَايَ اِنْ كُنْتُمْ لِلرُّءْيَا تَعْبُرُونَ) **- ey** (alimlər və) **əyanlar, əgər yuxu yozmağı bilirsinizsə, yuxumun yozumunu mənə xəbər verin.”**

**44)** (قَالُوٓا اَضْغَاثُ اَحْلَامٍ) **- dedilər: “**(sənin yuxun) **qarışıq** (və batil) **yuxulardır.** (وَمَا نَحْنُ بِتَأْوِيلِ الْاَحْلَامِ بِعَالِمِينَ) – **belə** (batil) **yuxuların yozumuna biz agah deyilik.** (O zaman zindandan qurtulan saqinin yadına Yusif düşdü)**.**

**45)** (وَقَالَ الَّذِي نَجَا مِنْهُمَا وَادَّكَرَ بَعْدَ اُمَّةٍ) – (zindandakı) **o iki nəfərdən biri olub nicat tapan** (saqi) **uzun zamandan sonra** (Yusifi) **xatırlayıb dedi:** (اَنَا اُنَبِّئُكُمْ بِتَأْوِيلِهِ) **- “Mən sizə bu yuxunun yozumunu xəbər verərəm.** (فَاَرْسِلُونِ) – (izin verib, yuxu yozmağı bilən şəxsin yanına) **məni göndərin.”** (Sizə xəbər gətirərəm. Padşah ona izin verdi, o da Yusifin yanına getdi)**.**

**46)** (يُوسُفُ اَيُّهَا الصِّدِّيقُ اَفْتِنَا فِي سَبْعِ بَقَرَاتٍ سِمَانٍ يَأْكُلُهُنَّ سَبْعٌ عِجَافٌ) – (saqi zindana gedib Yusifdən padşahın yuxusunun yozumunu soruşub dedi:) **“Ey Yusif, ey doğru adam, bu yuxunun yozumunu xəbər ver bizə: 7 arıq öküz 7 kök öküzü yedi,** (onlara da bir təsiri olmadı)**.** (وَسَبْعِ سُنْبُلَاتٍ خُضْرٍ وَاُخَرَ يَابِسَاتٍ) – **və 7** (təzə) **yaşıl sünbül də 7 quru sünbülə** (sarmaşıb onları yox elədi. Bunlar padşahın yuxusudur, yozumunu bəyan elə)**.** (لَعَلِّيٓ اَرْجِعُ اِلَى النَّاسِ لَعَلَّهُمْ يَعْلَمُونَ) – **bəlkə,**

قَالَ تَزْرَعُونَ سَبْعَ سِنِينَ دَاَبًاۚ فَمَا حَصَدْتُمْ فَذَرُوهُ فِي سُنْبُلِهٖٓ اِلَّا قَلِيلًا مِمَّا تَأْكُلُونَ ﴿٤٧﴾ ثُمَّ يَأْتِي
مِنْ بَعْدِ ذٰلِكَ سَبْعٌ شِدَادٌ يَأْكُلْنَ مَا قَدَّمْتُمْ لَهُنَّ اِلَّا قَلِيلًا مِمَّا تُحْصِنُونَ ﴿٤٨﴾ ثُمَّ يَأْتِي مِنْ بَعْدِ ذٰلِكَ
عَامٌ فِيهِ يُغَاثُ النَّاسُ وَفِيهِ يَعْصِرُونَ ۟ ﴿٤٩﴾ وَقَالَ الْمَلِكُ ائْتُونِي بِهٖۚ فَلَمَّا جَٓاءَهُ الرَّسُولُ

---

**mən insanların yanına qayıdıb** (yuxunun yozumunu bəyan edim, onlar da agah olsunlar)**.**

**47)** (قَالَ) – (Yusif yuxunun yozumundan ötrü cavab verib) **dedi: "**(7 kök öküz və 7 təzə yaşıl sünbül 7 bol nemət ilidir, bundan sonra 7 il bolluq olacaq, amma 7 arıq öküz və 7 quru sünbül o 7 il nemətdən sonra 7 il qəhətlik olacaq deməkdir." Hz. Yusif sonra 7 illik qəhətlikdən ötrü nə tədarük görmək lazımdır, onu bəyan edir)**.** (تَزْرَعُونَ سَبْعَ سِنِينَ دَاَبًا) -(əvvəlcə) **"7 il adət üzrə əkərsiniz.** (فَمَا حَصَدْتُمْ فَذَرُوهُ فِي سُنْبُلِهٖٓ اِلَّا قَلِيلًا مِمَّا تَأْكُلُونَ) – **yediyiniz az bir miqdar istisna olmaqla, o əkindən biçdiyinizin sünbülünü saxlayın qalsın,** (ta ki xarab olmasın. Sünbüldə saxlamayıb, çıxartsanız, içinə qurd düşüb xarab olar)**.**

**48)** (ثُمَّ يَأْتِي مِنْ بَعْدِ ذٰلِكَ سَبْعٌ شِدَادٌ) – (yeddi nemət ili keçəndən) **sonra 7** (şiddətli) **qəhətlik illəri gələr.** (يَأْكُلْنَ مَا قَدَّمْتُمْ لَهُنَّ اِلَّا قَلِيلًا مِمَّا تُحْصِنُونَ) – (o 7 bolluq ilində) **topladığınızı** (7 qıtlıq ilində) **yeyər, ancaq az bir qismini** (toxumluq üçün) **mühafizə edib saxlayarsınız."** (Ondan sonra Hz.Yusif onlara müjdə verir)**.**

**49)** (ثُمَّ يَأْتِي مِنْ بَعْدِ ذٰلِكَ عَامٌ فِيهِ يُغَاثُ النَّاسُ) – **"**(o 7 qıtlıq ilindən) **sonra bir il gələr, o ildə insanlara ilahi rəhmət** (yağış) **yağar.** (وَفِيهِ يَعْصِرُونَ)– (və o ildə cəmi meyvələr əmələ gəlib (zeytun, küncüd kimi) yağına ehtiyac olunan meyvələri) **sıxıb** (yağını çıxararlar." Saqi gedib yuxunun yozumunu və Yusifin əhvalatını padşaha bəyan edib bildirdi. Padşah dedi: "Bu hikmətli, aqil şəxsi mənim hüzuruma gətirin", necə ki ayədə buyurur)**.**

**50)** (وَقَالَ الْمَلِكُ ائْتُونِي بِهٖ) – (padşah) **dedi: "**(Yusifi) **mənim hüzuruma gətirin.** (فَلَمَّا جَٓاءَهُ الرَّسُولُ) **- padşahın elçisi Yusifin yanına gəlib onu padşah hüzuruna dəvət etdikdə,** (Yusif getməkdən imtina* edib getmədi. Əvvəlcə padşahın yanında Züleyxa məsələsində özünün müqəssir olmadığını sübut edib, ondan sonra oradan çıxmaq istədi).

*(*Qeyd:* *Uca peyğəmbərimiz buyurubdur: "Mən Yusifin səbir və mərifətinə təəccüb edirəm. Elçi gəlib ondan yuxunun yozumunu soruşanda demədi ki, məni zindandan çıxarın, sonra deyərəm. Əgər mən onun yerinə olsaydım, öncə şərt qoşardım ki, məni zindandan çıxarın, ondan sonra yuxunun yozumunu bəyan edəcəyəm. Bir də onun səbirinə təəccüb edirəm, padşah tərəfindən elçi gəlib, - padşah səni çağırır, dedikdə, zindandan çıxmadı. Dedi: "Gedib padşahdan soruşun ki, mənim nə təqsirim var idi ki, bunca müddətdir zindandayam?" Əgər mən onun yerində olsaydım, dərhal zindandan çıxardım. (Hz. Peyğəmbər: "Kərim şəxs kimdir?" – deyə soruşanlara Yusifi vəsf edərək*

قَالَ ارْجِعْ اِلٰى رَبِّكَ فَسْئَلْهُ مَا بَالُ النِّسْوَةِ الّٰتِي قَطَّعْنَ اَيْدِيَهُنَّ اِنَّ رَبِّي بِكَيْدِهِنَّ عَلِيمٌ ﴿٥٠﴾ قَالَ مَا خَطْبُكُنَّ اِذْ رَاوَدْتُنَّ يُوسُفَ عَنْ نَفْسِهٖ قُلْنَ حَاشَ لِلّٰهِ مَا عَلِمْنَا عَلَيْهِ مِنْ سُوٓءٍ قَالَتِ امْرَاَتُ الْعَزِيزِ الْـٰٔنَ حَصْحَصَ الْحَقُّ اَنَا رَاوَدْتُهُ عَنْ نَفْسِهٖ وَاِنَّهُ لَمِنَ الصَّادِقِينَ ﴿٥١﴾ ذٰلِكَ لِيَعْلَمَ اَنِّي لَمْ اَخُنْهُ بِالْغَيْبِ وَاَنَّ اللّٰهَ لَا يَهْدِي كَيْدَ الْخَآئِنِينَ ﴿٥٢﴾ وَمَآ اُبَرِّئُ نَفْسِيۚ اِنَّ النَّفْسَ لَاَمَّارَةٌ بِالسُّوٓءِ

---

*belə deyibdir: "Kərim kərim oğlu, o da kərim oğlu, o da kərim oğlu Yusif Yaqub oğlu, İshaq oğlu, İbrahim oğludur"* (*Buxari, Ənbiya 19; Əhməd b. Hənbəl, Müsnəd, II/96, 332*)).

(قَالَ ارْجِعْ اِلٰى رَبِّكَ) – (Yusif padşahın elçisinə) **dedi: "Qayıdıb padşahın yanına get.** (فَسْئَلْهُ مَا بَالُ النِّسْوَةِ الّٰتِي قَطَّعْنَ اَيْدِيَهُنَّ) – (padşahdan) **soruş ki,** (süfrədə yemək üstündə) **əllərini kəsən o qadınların hal və nişanları nə idi?"** (Nədən ötrü əllərini kəsdilər? Qoy bu mətləbdən xəbərdar olsun. Padşah bu mətləbdən xəbərsiz olduğuna görə, Hz. Yusif onun elçisinə bu sözü dedi ki, padşah özü bu mətləbi araşdırıb, onun məsumluğu üzə çıxsın, o, ədəbə riayət edib Züleyxanın adını çəkmədi). (اِنَّ رَبِّي بِكَيْدِهِنَّ عَلِيمٌ) **- həqiqətən, mənim rəbbim Allah-Təala** (hiylə edən o arvadların) **məkr və hiyləsindən agahdır.** (Amma Allah-Təala məni onların hiyləsindən xilas etdi. Padşahın elçisi qayıdıb Yusifin sözünü padşaha deyəndə, padşah çaşbaş qaldı. Ondan sonra araşdırıb mətləbdən xəbərdar olub, Züleyxanı və ondan başqa məclisdə olan qadınları çağırıb istintaq etdi**).**

**51)** (قَالَ مَا خَطْبُكُنَّ اِذْ رَاوَدْتُنَّ يُوسُفَ عَنْ نَفْسِهٖ) – (padşah) **qadınlara dedi: "Yusifdən kam almaq istəyib özünüzə dəvət etdikdə, sizin məqsədiniz nə idi?"** (Yusifdən sizə bir meyil, ya da bir xəyanət gördünüzmü?) (قُلْنَ حَاشَ لِلّٰهِ مَا عَلِمْنَا عَلَيْهِ مِنْ سُوٓءٍ) – (qadınlar Yusifin iffət və ismətini iqrar edib) **dedilər: "Allah-Təala hər bir eyib və nöqsandan pakdır.** (Yalandan şəhadət etmək doğru olmayıb doğru şəhadət edirik ki, biz Yusifin barəsində) **heç bir günah, xəyanət bilmirik.** (قَالَتِ امْرَاَتُ الْعَزِيزِ) - (Züleyxa gördü ki, qadınlar doğru şəhadət edirlər, əgər o da doğruyu iqrar etməsə, rüsvay olacaqdır və bu səbəbdən doğrunu iqrar etdi**), vəzirin arvadı dedi:** (الْـٰٔنَ حَصْحَصَ الْحَقُّ) **- "İndi haqq sabit oldu.** (اَنَا رَاوَدْتُهُ عَنْ نَفْسِهٖ) **- mən ondan kam almaq istəyib** (özümə dəvət etdim), (وَاِنَّهُ لَمِنَ الصَّادِقِينَ) **- həqiqətən,** (Yusif hər bir əməlində və sözündə) **doğru şəxslərdəndir."**

**52)** (ذٰلِكَ لِيَعْلَمَ اَنِّي لَمْ اَخُنْهُ بِالْغَيْبِ) - (Züleyxa deyir:) **mənim öz xəyanətimi iqrar etməyim ondan ötrüdür ki, qoy** (Yusif) **bilsin ki, o, qeybdə** (zindanda) **olsa da, mən ona xəyanət etməyib** (sözün düzünü və doğrusunu bəyan elədim). (وَاَنَّ اللّٰهَ لَا يَهْدِي كَيْدَ الْخَآئِنِينَ) **- həqiqətən, Allah-Təala xainlərin məkr və hiylələrini** (möhkəm etməyib) **onları arzularına qovuşdurmaz.**

**53)** (وَمَآ اُبَرِّئُ نَفْسِيۚ اِنَّ النَّفْسَ لَاَمَّارَةٌ بِالسُّوٓءِ) **- mən** (Yusifə isnad edib) **özümü təmizə çıxarmıram. Həqiqətən, nəfs insanı günaha cəlb edəndir.** (Asi nəf-

اِلَّا مَا رَحِمَ رَبِّيۜ اِنَّ رَبِّي غَفُورٌ رَحِيمٌ ﴿٥٣﴾ وَقَالَ الْمَلِكُ ائْتُونِي بِهٖٓ اَسْتَخْلِصْهُ لِنَفْسِيۚ فَلَمَّا كَلَّمَهُ
قَالَ اِنَّكَ الْيَوْمَ لَدَيْنَا مَكِينٌ اَمِينٌ ﴿٥٤﴾ قَالَ اجْعَلْنِي عَلٰى خَزَآئِنِ الْاَرْضِۚ اِنِّي حَفِيظٌ عَلِيمٌ ﴿٥٥﴾

---

simə tabe olub Yusif barəsində bu əməli etdim). (اِلَّا مَا رَحِمَ رَبِّي) – (insanın nəfsi asidir), **ancaq rəbbim Allah-Təalanın rəhm edib** (pis əməldən qoruduğu) **istisnadır,** (اِنَّ رَبِّي غَفُورٌ رَحِيمٌ) **- həqiqətən, mənim rəbbim Allah-Təala** (tövbə edən günahkarlara) **rəhm edib onları bağışlayandır."** (Bu ayə Züleyxanın mömin olduğuna işarə etməz, çünki Allah-Təalanı inkar edənlərə müşrik deyilməz. Necə ki Məkkə əhli müşrik və bütpərəst olmaqla birlikdə, Allah-Təalaya inanıb, bütləri Allah-Təala yanında özlərindən ötrü şəfaətçi sayırdılar)**.**

**54)** (وَقَالَ الْمَلِكُ ائْتُونِي بِهٖٓ اَسْتَخْلِصْهُ لِنَفْسِي) – (ondan sonra) **padşah** (əmr buyurub) **dedi: "**(Yusifi) **mənim yanıma gətirin. Ta ki onu özümdən ötrü** (səltənət işlərinə yardımçı) **təyin edim."** (Padşah əmr buyurdu ki, yaxşı libaslar və gözəl at gətirib, vəzirlər və əmirlər Yusifdən ötrü zindana getsinlər. Zindana gedib Yusifi zindandan çıxaranda zindan əhli onun ayrılığına ağladılar. Yusif onlara səbir etməyi əmr etdi. Ondan sonra Yusifi böyük cah-cəlalla padşahın hüzuruna gətirdilər. Padşah onunla danışıb onu hər bir elm və fəndə kamil gördü. Yusif onunla ibrani dilində danışdı, padşah bu dli bilmədiyindən soruşdu ki, ey Yusif, bu nə dildir? Dedi: "Ata-babalarımın dilidir", -soyunu padşaha bəyan edib padşahın nəzərində daha da böyüdü.) (فَلَمَّا كَلَّمَهُ) **– elə ki** (padşah Yusiflə) **danışıb,** (onun kamal, əql və fərasətinə agah olduqda)**,** (قَالَ اِنَّكَ الْيَوْمَ لَدَيْنَا مَكِينٌ اَمِينٌ) – (Yusif) **dedi: "Həqiqətən, bu gün sən bizim yanımızda böyük məqam və mərtəbə sahibi olub, səni** (hər bir əməl və sirrimizə) **əmin, etibarlı şəxs** (elədik. Ondan sonra padşah dedi: "Ey Yusif, xahiş edirəm, yuxumun yozumunu bir də sənin özündən eşidim. Yusif yuxunun yozumunu bəyan edib, 7 il əkinlə məşğul olmağın vacibliyini bəyan etdi. Padşah dedi: "Sənə ixtiyar verdim, ərzaqı toplayıb qoru. Qıtlıq ilində hər bir tərəfdən çəkilin, camaata ərzaq satıb böyük xəzinələr sahibi olarsan)**.**

**55)** (قَالَ اجْعَلْنِي عَلٰى خَزَآئِنِ الْاَرْضِ) – (Yusif) **dedi:** (bu işdə xəzinə lazımdır), **məni** (Misir) **torpağının xəzinələrinə sahib edib,** (Misirin xəzinələrini mənim ixtiyarıma ver)**.** (اِنِّي حَفِيظٌ عَلِيمٌ) **- həqiqətən, mən** (xəzinələri) **mühafizə etməyə** (və onun idarəsinə) **agaham.** (Padşah əmr edib, Yusifdən ötrü taxt-tac hazırladılar. Öz üzüyünü Yusifə verib Qıtfiri işdən çıxartdı. Yusif dedi: "Taxt və üzüyünlə səltənətini möhkəm edib mülkünü abad edərəm, amma tac bizim libasımız deyil." Padşah dedi: "Ucalığına və fəzilətinə görə, gərək onu başına qoyasan." Yusif itaət edib taxta oturdu. Əmirlər, vəzirlər ona tabe oldular. Bir müddətdən sonra Qıtfir öldü. Fironun əmriylə Yusif Züleyxa ilə evləndi. Zifaf günü Yusif gördü ki, o, bakirədir. Yusif dedi: "Ey Züleyxa, bu yaxşıdır, yoxsa məni daha əvvəl dəvət etdiyin şey?" Züleyxa dedi: "Ey Yusif, məni məzəm-

وَكَذٰلِكَ مَكَّنَّا لِيُوسُفَ فِي الْاَرْضِۚ يَتَبَوَّاُ مِنْهَا حَيْثُ يَشَآءُۜ نُصِيبُ بِرَحْمَتِنَا مَنْ نَشَآءُ وَلَا نُضِيعُ اَجْرَ الْمُحْسِنِينَ ﴿٥٦﴾ وَلَاَجْرُ الْاٰخِرَةِ خَيْرٌ لِلَّذِينَ اٰمَنُوا وَكَانُوا يَتَّقُونَ ۟ ﴿٥٧﴾ وَجَآءَ اِخْوَةُ يُوسُفَ فَدَخَلُوا عَلَيْهِ فَعَرَفَهُمْ وَهُمْ لَهُ مُنْكِرُونَ ﴿٥٨﴾

---

mət etmə, mən cavan bir qadın, Qıtfirdə isə kişilikdən bir əlamət yox idi. Xəbis nəfsi-əmmarə güc gəlib o əməllərə bais oldum. Yusifin Züleyxadan iki oğlu oldu, biri Əfrayim, o birisi Mişa (Manaşşe) idi . Yusif xəzinələrin qapısını açıb əkinlə məşğul olmağa başladı)**.**

**56)** (وَكَذٰلِكَ مَكَّنَّا لِيُوسُفَ فِي الْاَرْضِ) **-** (Allah-Təala Yusifi bəladan qurtarandan sonra ona bol nemət verdiyini bu ayədə bəyan buyurur)**. Habelə** (Misir) **torpağında Yusifə qüdrət və ixtiyar verdik.** (يَتَبَوَّاُ مِنْهَا حَيْثُ يَشَآءُ) – (Misirin istədiyi yerində) **istədiyi kimi hərəkət edib** (məskən salırdı. Bütün Misir ona tabe olduğundan ona mane olan yox idi)**.** (نُصِيبُ بِرَحْمَتِنَا مَنْ نَشَآءُ) – **istədiyimizə rəhmətimizi nəsib edib,** (dünyada ona mal-mülk, cah-cəlal və səltənət verərik)**.** (وَلَا نُضِيعُ اَجْرَ الْمُحْسِنِينَ) **- yaxşı əməl sahiblərinin əcrlərini zay etmərik,** (hətta kafir və müşrik də olsalar, dünyadakı mükafatlarını verərik)**.**

**57)** (وَلَاَجْرُ الْاٰخِرَةِ خَيْرٌ لِلَّذِينَ اٰمَنُوا وَكَانُوا يَتَّقُونَ) **– və əlbəttə, iman gətirib,** (pis əməldən) **çəkinən müttəqilər üçün axirətin əcri** (dünya əcrindən) **yaxşıdır.** (Hz.Yusif 7 il əkinlə məşğul olub həddən çox buğda, arpa və başqa dənli bitkilər toplayıb saxladı. 7 il keçəndən sonra səmadan yağış kəsilib, sular azalıb, əkinlər quruyub qıtlıq başladı. Ətraf bölgə xalqlarının ərzağı qurtardığından Misirə yönəldilər. Necə ki Misirdə qıtlıq idi, Fələstin, Şam, İraqda da qıtlıq oldu. Yusifin atası, qardaşları Fələstin ərazisində, Kənanda sakin olurdular. Qıtlığa düçar oldular. Misirdə buğda olduğunu bilib Misirə getməyə qərar verdilər. Yaqub 10 oğlunu buğda almaqdan ötrü Misirə yola salıb Bünyamini yanında saxladı. Onlar bir qədər dəri parçası və başmaq götürüb Misirə yola düşdülər. Gedib Misirə çatıb, bir qədər dincələndən sonra buğdadan ötrü Yusifin hüzuruna getdilər. Necə ki gələn ayədə buyurur)**.**

*(*Qeyd: Misirdə dəfələrlə qıtlıq olubdur. Hamısından şiddətlisi h. 462-ci ildən sonra Fatimi xəlifələrindən əl-Müstənsir Billah zamanında olubdur. Elə qıtlıq oldu ki, xəlifənin atası və qızları aclıqdan Bağdada getdilər. Təfsilatı tarix kitablarında qeyd olunubdur).*

**58)** (وَجَآءَ اِخْوَةُ يُوسُفَ فَدَخَلُوا عَلَيْهِ) **- Yusifin qardaşları** (Misirə) **gəlib** (Yusifin) **hüzuruna daxil oldular.** (فَعَرَفَهُمْ وَهُمْ لَهُ مُنْكِرُونَ) **-** (Yusif) **onları tanıdı.** (Amma qardaşları Yusifi tanımadılar. Yusifin hüzuruna daxil olanda Yusifdən kənarda, ehtiyac sahiblərinin durduğu yerdə durdular. Yusifi sultan libasında görəndə xəyallarına gəldi ki, bəlkə də, bu Yusifdir. Lakin ondan çox uzun zaman öncə ayrıldıqlarından Yusifin məhv olduğunu zənn edib öldüyünə əmin

وَلَمَّا جَهَّزَهُمْ بِجَهَازِهِمْ قَالَ ائْتُونِي بِاَخٍ لَكُمْ مِنْ اَبِيكُمْ ۚ اَلَا تَرَوْنَ اَنِّيٓ اُوفِي الْكَيْلَ وَاَنَا۠ خَيْرُ الْمُنْزِلِينَ ﴿٥٩﴾ فَاِنْ لَمْ تَأْتُونِي بِهٖ فَلَا كَيْلَ لَكُمْ عِنْدِي وَلَا تَقْرَبُونِ ﴿٦٠﴾ قَالُوا سَنُرَاوِدُ عَنْهُ اَبَاهُ وَاِنَّا لَفَاعِلُونَ ﴿٦١﴾

---

idilər. Yusif onları hüzuruna çağıranda onlar ibrani dilində danışdılar. Yusif də ibrani dilində onlara cavab verdi. Dedi: “Xəbər verin mənə, siz kimsiniz, işiniz, əməliniz nədir? Niyə bura gəlibsiniz? Mən sizin barənizdə bədgümanam.” Dedilər: “Biz Şam əhlindənik, özümüz də heyvandarıq, bizdə də başqalarında olduğu kimi qıtlıq baş verdi. Ərzaqdan ötrü gəlmişik.” Yusif dedi: “Bəlkə casussunuz ki, gəlib mənim məmləkətimin gizlin işlərinə agah olasınız.” Dedilər: “Bu töhmətdən Allah-Təalaya pənah aparırıq. Biz hamımız bir atanın oğluyuq, atamız bir qoca kişidir, Allah-Təalanın peyğəmbərlərindəndir, adı da Yaqubdur.” Yusif dedi: “Neçə nəfər qardaşsınız? Dedilər ki, 12 qardaş idik, biri həlak oldu.” Dedi: “Burada neçə nəfərsiniz?” Dedilər: “10 nəfərik.” Yusif dedi: “Bəs hanı 11-ci qardaşınız?” Dedilər: “O atamızın yanındadır. Ölən qardaşımıza görə onunla təsəlli tapır.” Dedi: “Sizin sözünüzün düz olduğuna kim şəhadət edər?” Dedilər: “Ey padşah, biz burada qəribik, bizi bir nəfər də tanıyan yoxdur.” Dedi: “Özünüzdən bir nəfəri mənim yanımda girov qoyun. Ondan sonra siz gedin. O biri qardaşınızı gətirin. Məlum olsun ki, siz doğru deyirsiniz, qoy o qardaşınız doğru olmanız barəsində atanızdan mənə xəbər gətirsin.” Yaqubun oğulları çarəsiz qalıb razı oldular, püşk atdılar, püşk Şəmuna düşdü, onu Yusifin yanında qoyub getdilər, necə ki Allah-Təala bu ayədə xəbər verir)**.**

**59)** (وَلَمَّا جَهَّزَهُمْ بِجَهَازِهِمْ) – (Yusif onların səfər ehtiyaclarını)**, yüklərini hazırlayıb** (hər birinə bir yük ərzaq verdi)**,** (قَالَ ائْتُونِي بِاَخٍ لَكُمْ مِنْ اَبِيكُمْ) – (onlara) **dedi:** (orada qalan) **atanızdan olan qardaşınız** (Bünyamini) **mənim yanıma gətirin.** (اَلَا تَرَوْنَ اَنِّيٓ اُوفِي الْكَيْلَ) – **bəs baxıb görmürsünüz ki, mən ölçünü necə düz edib** (sizə və hər bir şəxsə dürüstlüklə ərzaq verirəm? Bir də orada olan qardaşınızdan ötrü sizə bir yük artıq ərzaq verdim)**.** (وَاَنَا۠ خَيْرُ الْمُنْزِلِينَ) **- mən qonaqpərvərlərin ən yaxşısıyam,** (necə ki görürsünüz, qonaq olduğunuza görə sizə çox ehtiram edirəm)**.**

**60)** (فَاِنْ لَمْ تَأْتُونِي بِهٖ) **- əgər** (o biri qardaşınızı) **mənə gətirməsəniz,** (فَلَا كَيْلَ لَكُمْ عِنْدِي وَلَا تَقْرَبُونِ) – **məndən sizə** (bir “kilə” - 40 litr) **ərzaq da yoxdur.** (Bir də mənim yanıma, məmləkətimə gəlib) **yaxınlaşmayın.**

**61)** (قَالُوا سَنُرَاوِدُ عَنْهُ اَبَاهُ) **- dedilər: “Onu atasından alıb gətirmək üçün çox çalışıb** (məkr, hiylə edərik). (وَاِنَّا لَفَاعِلُونَ) **- həqiqətən,** (xəta və süstlük etməyib sənin əmr etdiyini) **edərik.”**

وَقَالَ لِفِتْيَانِهِ اجْعَلُوا بِضَاعَتَهُمْ فِي رِحَالِهِمْ لَعَلَّهُمْ يَعْرِفُونَهَآ اِذَا انْقَلَبُوٓا اِلٰٓى اَهْلِهِمْ لَعَلَّهُمْ يَرْجِعُونَ
﴿٦٢﴾ فَلَمَّا رَجَعُوٓا اِلٰٓى اَبِيهِمْ قَالُوا يَآ اَبَانَا مُنِعَ مِنَّا الْكَيْلُ فَاَرْسِلْ مَعَنَآ اَخَانَا نَكْتَلْ وَاِنَّا لَهُ لَحَافِظُونَ
﴿٦٣﴾ قَالَ هَلْ اٰمَنُكُمْ عَلَيْهِ اِلَّا كَمَآ اَمِنْتُكُمْ عَلٰٓى اَخِيهِ مِنْ قَبْلُ فَاللّٰهُ خَيْرٌ حَافِظًا وَهُوَ اَرْحَمُ
الرَّاحِمِينَ ﴿٦٤﴾ وَلَمَّا فَتَحُوا مَتَاعَهُمْ وَجَدُوا بِضَاعَتَهُمْ رُدَّتْ اِلَيْهِمْ قَالُوا يَآ اَبَانَا مَا نَبْغِي هٰذِهِ
بِضَاعَتُنَا رُدَّتْ اِلَيْنَا وَنَمِيرُ اَهْلَنَا وَنَحْفَظُ اَخَانَا وَنَزْدَادُ كَيْلَ بَعِيرٍ ذٰلِكَ كَيْلٌ يَسِيرٌ ﴿٦٥﴾

---

**62)** (وَقَالَ لِفِتْيَانِهِ اجْعَلُوا بِضَاعَتَهُمْ فِي رِحَالِهِمْ) – (Yusif ərzaqı ölçən) **qulamlarına dedi: "Onların** (ərzaq əvəzinə gətirdiyi) **şeyləri** (onlardan xəbərsiz) **yüklərinin içinə qoyun ki,** (لَعَلَّهُمْ يَعْرِفُونَهَآ اِذَا انْقَلَبُوٓا اِلٰٓى اَهْلِهِمْ) - (ümid edirəm ki, vətənlərinə)**, ailələrinin yanına qayıdıb** (yüklərini açanda şeylərin onlara geri qaytarıldığını) **bilsinlər.** (لَعَلَّهُمْ يَرْجِعُونَ) – (və o vaxt da) **qayıdıb geri gələcəklərinə** (ümid edirəm)**."**

**63)** (فَلَمَّا رَجَعُوٓا اِلٰٓى اَبِيهِمْ) - (Yusifin qardaşları) **qayıdıb atalarının yanına getdikdə,** (Yusiflə olan əhvalatı atalarına nəql edib Şəmunun orada qaldığını və Şəmunun oradan xilas olmasının Bünyaminin ora getməsinə bağlı olduğunu ona xəbər verdilər). (قَالُوا يَآ اَبَانَا مُنِعَ مِنَّا الْكَيْلُ) **- dedilər: "Ey bizim atamız,** (əgər Bünyamini bizimlə göndərməsən, bundan sonra Misir padşahı) **ərzağı bizə qadağan edəcək.** (فَاَرْسِلْ مَعَنَآ اَخَانَا نَكْتَلْ) **- qardaşımız** (Bünyamini) **bizimlə göndər ki,** (onun səbəbinə ərzaq) **gətirək.** (وَاِنَّا لَهُ لَحَافِظُونَ) **- həqiqətən, biz onu, əlbəttə, mühafizə edib** (sənə gətirərik)**.**

**64)** (قَالَ هَلْ اٰمَنُكُمْ عَلَيْهِ اِلَّا كَمَآ اَمِنْتُكُمْ عَلٰٓى اَخِيهِ مِنْ قَبْلُ) – (Yaqub) **dedi: "Necə ki bundan qabaq onun qardaşı Yusifi sizə etibar etdim, onu da sizə etibar edim?** (Etmirəm)**.** (Yusifi aparanda da dediniz ki, biz onu qoruyarıq. Aparıb xəyanət edib tələf etdiniz. Ondan sonra Yaqub Allah-Təalaya təvəkkül edib dedi:) (فَاللّٰهُ خَيْرٌ حَافِظًا) **– ən yaxşı qoruyan Allah-Təaladır.** (وَهُوَ اَرْحَمُ الرَّاحِمِينَ) **- rəhm edənlərin ən mərhəmətlisidir.** (Ümidim budur ki, Bünyamini mühafizə edib iki günahı mənə yükləməsin)**.**

**65)** (وَلَمَّا فَتَحُوا مَتَاعَهُمْ) – (Misirdən gətirdikləri) **yüklərini açdıqda,** (وَجَدُوا بِضَاعَتَهُمْ رُدَّتْ اِلَيْهِمْ) – (ərzaq əvəzinə apardıqları) **şeylərinin** (yük içində) **onlara qaytarıldığını gördülər.** (قَالُوا يَآ اَبَانَا مَا نَبْغِي هٰذِهِ بِضَاعَتُنَا رُدَّتْ اِلَيْنَا) **- dedilər: "Bizim atamız, bundan artıq nə istəyirik?** (Misir padşahı bizə hədiyyə edib ərzaq əvəzinə apardığımız) **şeylərimizi bizə geri qaytarıbdır.** (Bundan artıq nə ehsan olar?) (وَنَمِيرُ اَهْلَنَا) – (bu şeyləri yenidən aparıb) **ailəmizdən ötrü ərzaq alıb gətirərik.** (وَنَحْفَظُ اَخَانَا) **- qardaşımız** (Bünyamini) **də qoruyarıq.** (وَنَزْدَادُ كَيْلَ بَعِيرٍ) – (Bünyamini apardığımız üçün) **bir dəvə yükü ərzaq da artıq** (alarıq)**.** (ذٰلِكَ كَيْلٌ يَسِيرٌ) **- bu** (gətirdiyimiz) **isə az olan ərzaqdır,** (bizə kifayət etməz. Əgər

قَالَ لَنْ اُرْسِلَهُ مَعَكُمْ حَتّٰى تُؤْتُونِ مَوْثِقًا مِنَ اللّٰهِ لَتَأْتُنَّنِي بِهٖٓ اِلَّآ اَنْ يُحَاطَ بِكُمْۚ فَلَمَّآ اٰتَوْهُ مَوْثِقَهُمْ قَالَ
اللّٰهُ عَلٰى مَا نَقُولُ وَكِيلٌ ﴿٦٦﴾ وَقَالَ يَا بَنِيَّ لَا تَدْخُلُوا مِنْ بَابٍ وَاحِدٍ وَادْخُلُوا مِنْ اَبْوَابٍ مُتَفَرِّقَةٍؕ
وَمَآ اُغْنِي عَنْكُمْ مِنَ اللّٰهِ مِنْ شَيْءٍؕ اِنِ الْحُكْمُ اِلَّا لِلّٰهِؕ عَلَيْهِ تَوَكَّلْتُۚ وَعَلَيْهِ فَلْيَتَوَكَّلِ الْمُتَوَكِّلُونَ ﴿٦٧﴾

---

Bünyamini aparsaq, ondan ötrü də böyük ərzaq alarıq. O vaxt da bizə kifayət edər)**.”**

**66)** (قَالَ لَنْ اُرْسِلَهُ مَعَكُمْ حَتّٰى تُؤْتُونِ مَوْثِقًا مِنَ اللّٰهِ لَتَأْتُنَّنِي بِهٖٓ اِلَّآ اَنْ يُحَاطَ بِكُمْ) – (Yaqub oğullarına xitab edib) **dedi: “Düşmən sizi əhatə edib** (məğlub, ya da həlak olmanız) **istisna, onu mənə gətirəcəyinizə dair Allah-Təalaya and içib mənə söz verədikcə,** (Bünyamini) **heç vaxt sizinlə göndərmərəm,** (çünki sizə etibarım yoxdur. Ancaq o zaman mənim sizə bir etirazım olmayıb sizdən narazı olmaram. Yaqubun oğulları hətta imkansız da olsa, Bünyamini mühafizə edib qaytarıb gətirməyə and içdilər. Yaqub da onlara Bünyamini aparmağa izin verdi)**.** (فَلَمَّآ اٰتَوْهُ مَوْثِقَهُمْ قَالَ اللّٰهُ عَلٰى مَا نَقُولُ وَكِيلٌ) **-** (Yaqubun oğulları Bünyamini qaytarıb gətirəcəklərinə) **and içib, atalarına söz verdilər.** (Yaqub) **dedi: “Allah-Təala bizim bu sözlərimizə** (mənə söz vermənizə) **şahid,** (vəkil və agahdır. Kim müxalifət etsə, Allah-Təala ona əzab edər.” Yaqubun oğulları gözəl və qədd-qamətli olduqlarından xalq arasında məşhur olan gözdəymədən çəkinib Misirə daxil olanda onlara hamısının bir qapıdan daxil olmalarını qadağan edib ayrı-ayrı qapılardan daxil olmalarını* əmr etdi. Necə ki sıradakı ayədə xəbər verir)**.**

*(*Qeyd: Yaqubun Misirə ilk dəfə gedəndə oğullarına bu vəsiyyəti əmr etməyib, ikinci dəfə əmr etməsinin səbəbi Yaqubun oğullarının ilk dəfə Misirə gedəndə camaat tərəfindən tanınmayıb, ikinci dəfə Yusifin mərhəmətiylə tanınmaları idi).*

**67)** (وَقَالَ يَا بَنِيَّ لَا تَدْخُلُوا مِنْ بَابٍ وَاحِدٍ وَادْخُلُوا مِنْ اَبْوَابٍ مُتَفَرِّقَةٍ) – (Yaqub oğullarına vəsiyyət edib) **dedi: “Ey mənim oğullarım,** (Misirə daxil olanda) **hamınız** (bir yerdə) **bir qapıdan daxil olmayın, bəlkə, ayrı-ayrı qapılardan** (hər iki-üçünüz bir qapıdan) **daxil olun.** (Ta ki sizə göz dəyməsin)**.** (وَمَآ اُغْنِي عَنْكُمْ مِنَ اللّٰهِ مِنْ شَيْءٍ) – (mənim oğullarım, mənim bu vəsiyyətimdə mən heç bir şeyin barəsində) **Allah-Təalanın** (təqdirini) **sizdən dəf edə bilmərəm,** (əgər Allah-Təala tərəfindən sizə bir zərər, hökm olunmuş olsa, mənim bu tədbirim o zərəri sizdən dəf edə bilməz, lakin sizi sevdiyimdən özümə təsəlli verməkdən ötrü sizə bu vəsiyyəti edirəm)**.** (اِنِ الْحُكْمُ اِلَّا لِلّٰهِ) – (hər bir) **hökm ancaq** (şəriksiz olan) **Allah-Təalaya məxsusdur.** (Heç kim onun bəndələrinin haqqında olan hökm və iradəsini dəf edə bilməz)**.** (عَلَيْهِ تَوَكَّلْتُ وَعَلَيْهِ فَلْيَتَوَكَّلِ الْمُتَوَكِّلُونَ) **- mən də** (hər bir işimdə, o cümlədən bu vəsiyyətimdə Allah-Təalaya təvəkkül etmişəm. Hər bir təvəkkül edən də gərək ancaq Allah-Təalaya təvəkkül edib (ondan başqasına təvəkkül etməsin)**.”**

وَلَمَّا دَخَلُوا مِنْ حَيْثُ اَمَرَهُمْ اَبُوهُمْ ۜ مَا كَانَ يُغْنِي عَنْهُمْ مِنَ اللّٰهِ مِنْ شَيْءٍ اِلَّا حَاجَةً فِي نَفْسِ
يَعْقُوبَ قَضٰيهَاۜ وَاِنَّهُ لَذُو عِلْمٍ لِمَا عَلَّمْنَاهُ وَلٰكِنَّ اَكْثَرَ النَّاسِ لَا يَعْلَمُونَ ۟ ﴿٦٨﴾ وَلَمَّا دَخَلُوا عَلٰى
يُوسُفَ اٰوٰىٓ اِلَيْهِ اَخَاهُ قَالَ اِنّ۪يٓ اَنَا اَخُوكَ فَلَا تَبْتَئِسْ بِمَا كَانُوا يَعْمَلُونَ ﴿٦٩﴾

---

**68)** (وَلَمَّا دَخَلُوا مِنْ حَيْثُ اَمَرَهُمْ اَبُوهُمْ) - (ey Məhəmməd), (Yaqubun oğulları Misirə çatıb) **atalarının əmr etdiyi kimi** (ora) **müxtəlif qapılardan daxil olduqda,** (مَا كَانَ يُغْنِي عَنْهُمْ مِنَ اللّٰهِ مِنْ شَيْءٍ اِلَّا حَاجَةً فِي نَفْسِ يَعْقُوبَ قَضٰيهَا) - (Yaqubun bu əmri) **Allah-Təalanın onlar haqqındakı təqdirini dəf etmədi.** (Hətta onlara oğurluq isnad edilib Misirdə rəzil oldular)**. Ancaq** (Yaqub) **öz diləyini** (oğullarına məhəbbət və mehribanlıq izhar etməyi) **əda etməkdən ötrü** (ayrı-ayrı qapılardan daxil olmağı onlara əmr etdi)**.** (وَاِنَّهُ لَذُو عِلْمٍ لِمَا عَلَّمْنَاهُ وَلٰكِنَّ اَكْثَرَ النَّاسِ لَا يَعْلَمُونَ) **- və həqiqətən,** (Yaqub) **biz ona öyrətdiyimiz üçün elm sahibiydi.** (və bu səbəbdən özü keçən ayədə hər bir hökmü Allah-Təalaya həvalə etdi)**, lakin xalqın əksəriyyəti** (Yaqubun) **elminə agah olmayıb** (hər bir hökmü Allah-Təalaya həvalə etmirlər. Elə ki Yaqubun oğulları Yusifin hüzuruna getdilər, dedilər: "O qardaşımız ki, onu gətirməyi bizə əmr etmişdin, budur, gətirmişik." Yusif dedi: "Çox gözəl iş görüb, xeyirə çatıbsınız və bu xeyiri mənim yanımda tapacaqsınız", onlara ehtiram edib onlardan ötrü mənzillər təyin etdi, onlar da rahatlandılar. Ondan sonra onları öz mənzilinə qonaq dəvət edib, hər iki qardaşı bir süfrəyə əyləşdirdi. Bünyamin tək qalıb ağlayıb dedi: "Əgər mənim qardaşım Yusif həyatda olsaydı, mənimlə bir süfrədə əyləşərdi." Yusif dedi: "Bu qardaşınız tək qaldı, onu özümlə süfrəyə əyləşdirərəm." Özüylə əyləşdirib, yeməyi yeyib qurtarandan sonra dedi: "Siz qardaşlar hər ikiniz bir yerdə yatın, bu qardaşınız tək qaldığına görə mənim yanımda yatsın." Yaqubun oğulları razı oldular. Lakin Rubin dedi: "Mən bu Misir vəzirinin belə rəftarına təəccüb edirəm." Gecə olub Yusif Bünyamin ilə tək qaldıqda, soruşdu: "Sənin adın nədir?" Dedi: "Bünyamin." Yusif dedi: "Ananın adı nədir?" Dedi: "Rahil", dedi: "Sənin anabir qardaşın varmı?" Bünyamin dedi: "Bir qardaşım var idi, həlak oldu." Yusif dedi: "Həlak olan qardaşının əvəzində mənim sənə qardaş olmağımı istəyərsənmi?" Bünyamin dedi: "Sənin kimi qardaşı kim tapa bilər, lakin Yaqub və Rahildən doğulmayıbsan." Bu zaman Yusif daha özünü saxlaya bilməyib ağlayıb, Bünyamini qucaqlayıb dedi: "Qardaşın Yusif mənəm." Hər ikisi ağlayıb bir yataqda uzanıb, sübhə kimi bir-birlərini qucaqlayıb iylədilər, necə ki gələn ayədə xəbər verir)**.**

**69)** (وَلَمَّا دَخَلُوا عَلٰى يُوسُفَ اٰوٰىٓ اِلَيْهِ اَخَاهُ قَالَ اِنّ۪يٓ اَنَا اَخُوكَ فَلَا تَبْتَئِسْ بِمَا كَانُوا يَعْمَلُونَ) **-** (Yaqubun oğulları) **Yusifin hüzuruna daxil olduqda,** (Yusif qardaşı Bünyamini) **öz yanına çəkib dedi: "Qardaşın** (Yusif) **mənəm,** (bu qardaşlarının bizim haqqımızda elədiyi pis) **əməllərə məhzun olma.** (Allah-Təala bizi çox yaxşı şəkildə bir məqama topladı, lakin mənim Yusif olduğumu qardaşlarına

فَلَمَّا جَهَّزَهُمْ بِجَهَازِهِمْ جَعَلَ السِّقَايَةَ فِي رَحْلِ اَخِيهِ ثُمَّ اَذَّنَ مُؤَذِّنٌ اَيَّتُهَا الْعِيرُ اِنَّكُمْ لَسَارِقُونَ
﴿٧٠﴾ قَالُوٓا وَاَقْبَلُوا عَلَيْهِمْ مَاذَا تَفْقِدُونَ ﴿٧١﴾ قَالُوا نَفْقِدُ صُوَاعَ الْمَلِكِ وَلِمَنْ جَٓاءَ بِهٖ حِمْلُ بَعِيرٍ
وَاَنَا بِهٖ زَعِيمٌ ﴿٧٢﴾ قَالُوا تَاللّٰهِ لَقَدْ عَلِمْتُمْ مَا جِئْنَا لِنُفْسِدَ فِي الْاَرْضِ وَمَا كُنَّا سَارِقِينَ ﴿٧٣﴾ قَالُوا
فَمَا جَزَٓاؤُهُٓ اِنْ كُنْتُمْ كَاذِبِينَ ﴿٧٤﴾

---

bildirmə." Elə ki Bünyamin qardaşı Yusifi tanıdı, bir daha səndən ayrılmaram deyib, Yusifdən möhkəm yapışdı. Yusif dedi: "Əgər burada qalsan, atamızın qəm-qüssəsi daha da artar və bir də gərək sənə bir böhtan atıb, o bəhanə ilə səni qardaşlarından alıb saxlayam." Bünyamin dedi: "Necə məsləhət görürsən, elə də elə, mən səndən ayrılan deyiləm." Bundan sonra Yusif padşahın su içdiyi camı Bünyaminin buğda çuvalının içinə qoydu, qardaşlarının da hər birinə xeyli buğda verib yola saldı. (Necə ki sıradakı ayədə xəbər verir)**.**

**70)** (فَلَمَّا جَهَّزَهُمْ بِجَهَازِهِمْ جَعَلَ السِّقَايَةَ فِي رَحْلِ اَخِيهِ) **-** (Yusif qardaşlarının) **tədarükünü hazırlayıb** (çuvallarını buğda ilə doldurduqda, padşahın) **su camını qardaşı** (Bünyaminin) **yükünün içinə qoydu.** (Yola düşdülər). (ثُمَّ اَذَّنَ مُؤَذِّنٌ اَيَّتُهَا الْعِيرُ اِنَّكُمْ لَسَارِقُونَ) – (onlar yola düşəndən sonra Yusif tərəfindən olan) **carçı** (arxalarınca onlara səslənib) **dedi: "Ey karvan əhli,** (durun)**, siz oğrularsınız."**

**71)** (قَالُوٓا وَاَقْبَلُوا عَلَيْهِمْ مَاذَا تَفْقِدُونَ) **-** (Yusifin qardaşları onlara oğruluq isnad edilməsindən üzülüb, carçıya) **dönüb dedilər: "Nə** (istəyirsiniz ki,) **axtarırsınız?"**

**72)** (قَالُوا نَفْقِدُ صُوَاعَ الْمَلِكِ) – (Yusifin xidmətçiləri) **dedilər: "Padşahın su camını** (itirmişik, onu) **axtarırıq,** (وَلِمَنْ جَٓاءَ بِهٖ حِمْلُ بَعِيرٍ وَاَنَا بِهٖ زَعِيمٌ) **- kim o camı** (götürüb) **versə, ondan ötrü** (müjdə)**, bir dəvə yükü də ərzaq vardır. Mən** (carçı) **o şəxsə bu ərzağı verməyə zaminəm."**

**73)** (قَالُوا تَاللّٰهِ لَقَدْ عَلِمْتُمْ مَا جِئْنَا لِنُفْسِدَ فِي الْاَرْضِ وَمَا كُنَّا سَارِقِينَ) – (Yaqubun oğulları təəccüblənib) **dedilər: "And olsun Allah-Təalaya, siz özünüz* bilirsiniz ki,** (Misir) **torpağında fəsad törətməkdən ötrü gəlməmişik və heç vaxt da oğru olmayıb** (belə çirkin əmələ yönəlməmişik. İndi necə ola bilər ki, biz oğurluq edək?)**"**

*(*Qeyd: Yaqubun oğulları iki dəfə Misirə gedib heç bir pis iş etmədiklərindən, xüsusən Yusifin xidmətçilərinin arasında namuslu və məsum olmaları ilə tanındıqlarından bu barədə də onların özlərinə istinad etdilər).*

**74)** (قَالُوا فَمَا جَزَٓاؤُهُٓ اِنْ كُنْتُمْ كَاذِبِينَ) **-** (Yusifin xidmətçiləri) **dedilər: "Əgər yalançı olub** (oğruluq etdiyiniz aşkar olsa, o oğrunun) **cəzası nədir?"** (Yusifin xidmətçilərinin bu sualı verməkdə məqsədi onların öz şəriətləriylə onlara cavab və cəza vermək idi ki, Bünyamini tutub saxlayanda bir şey deyə bilməsinlər. Xidmətçilər Yusifin təlimiylə onlara belə dedilər. Hz. İbrahimin

قَالُوا جَزَٓاؤُهُ مَنْ وُجِدَ فٖي رَحْلِهٖ فَهُوَ جَزَٓاؤُهُۜ كَذٰلِكَ نَجْزِي الظَّالِمٖينَ ﴿٧٥﴾ فَبَدَاَ بِاَوْعِيَتِهِمْ قَبْلَ وِعَٓاءِ اَخٖيهِ ثُمَّ اسْتَخْرَجَهَا مِنْ وِعَٓاءِ اَخٖيهِۜ كَذٰلِكَ كِدْنَا لِيُوسُفَۜ مَا كَانَ لِيَأْخُذَ اَخَاهُ فٖي دٖينِ الْمَلِكِ اِلَّٓا اَنْ يَشَٓاءَ اللّٰهُۜ نَرْفَعُ دَرَجَاتٍ مَنْ نَشَٓاءُۜ وَفَوْقَ كُلِّ ذٖي عِلْمٍ عَلٖيمٌ ﴿٧٦﴾

---

şəriətində oğurladığı şeyə qarşılıq oğrunun cəzası onu bir il zorla saxlayıb işlətmək idi və bu səbəbdən Yusif Bünyamini saxlamaqdan ötrü belə tədbir gördü)**.**

**75)** (قَالُوا جَزَٓاؤُهُ مَنْ وُجِدَ فٖي رَحْلِهٖ) – (Yaqubun oğulları özlərinə arxayın olduqlarına görə, cəsarətlə belə cavab verib) **dedilər: “Kimin yükündən tapılsa,** (o oğurluğun) **cəzası o şəxsin özünü** (tutub işlətməkdir)**.** (فَهُوَ جَزَٓاؤُهُ كَذٰلِكَ نَجْزِي الظَّالِمٖينَ) – (oğrudan başqası yox, ancaq özü öz günahının cəzasını çəkər) **və biz zalım** (oğrulara) **belə cəza verib** (oğurlanan şeyin əvəzində onların özünü tutub işlədərik.” Bu danışıqdan sonra onları qaytarıb Yusifin yanına apardılar. Yusif qardaşı Bünyaminin yükündən qabaq digərlərinin yükünü axtarıb bir şey tapılmayanda, Bünyaminin yükünü axtarmaqdan vaz keçib dedi: “Onu axtarmaq lazım deyil, sizdə yoxdur.” Qardaşlar dedilər: “Lakin arxayın olmaqdan ötrü gərək Bünyaminin də yükünü axtarasan.” Axtarıb camı onun yükündən tapdılar. Yaqubun oğulları xəcalət çəkib, qəzəblərindən az qaldılar ki, ölsünlər, necə ki sıradakı ayədə xəbər verir)**.**

**76)** (فَبَدَاَ بِاَوْعِيَتِهِمْ قَبْلَ وِعَٓاءِ اَخٖيهِ ثُمَّ اسْتَخْرَجَهَا مِنْ وِعَٓاءِ اَخٖيهِ) - (Yusif) **qardaşı** (Bünyaminin) **yükündən qabaq o biri qardaşlarının yüklərini axtarmağa başladı.** (Onların yükündən cam çıxmayıb ondan sonra qardaşı Bünyaminin yükünü axtarıb) **camı onun yükündən** (tapıb) **çıxartdı.** (كَذٰلِكَ كِدْنَا لِيُوسُفَ مَا كَانَ لِيَأْخُذَ اَخَاهُ فٖي دٖينِ الْمَلِكِ اِلَّٓا اَنْ يَشَٓاءَ اللّٰهُ) – (ey Məhəmməd)**, Yusif qardaşı** (Bünyamini Misir) **padşahının qanunuyla tutmaq istəməyib, ancaq Allah-Təalanın tədbirini** (istədiyindən, biz qardaşlarının istəyi və Hz. İbrahimin şəriətinə əsasən Bünyamini tutub saxlama) **tədbirini Yusifə öyrətdik.** (Misir padşahının qanunu oğurlanan şeyin ikiqat qiymətini oğrudan almaq idi)**.** (نَرْفَعُ دَرَجَاتٍ مَنْ نَشَٓاءُ وَفَوْقَ كُلِّ ذٖي عِلْمٍ عَلٖيمٌ) - (ey Məhəmməd, Yusifin elmdəki dərəcəsini artırdığımız kimi) **kimi istəsək, onun dərəcəsini artırarıq.** (Lakin elmdə müxtəlif dərəcələr vardır)**, hər bir elm sahibinin üstündə başqa bir** (elm sahibi) **var.** (Hamısının da üstündə Allah-Təala var. Cam Bünyaminin yükündən çıxdıqda, qardaşları xəcalət çəkib, başlarını aşağı salıb dedilər: “Ey Rahil oğulları, bu nə işdir? Bizi rəzil edib üzümüzü qara elədiniz. Həmişə sizdən bizə bəla yetişir.” Bünyamin dedi: “Bəla sizdən bizə yetişibdir, qardaşımı aparıb həlak elədiniz, mənim bu camdan xəbərim yoxdur. İlk dəfə Misirdən qayıdanda Misirə apardığınız malları sizin yükünüzə kim qoyubsa, bu camı da mənim yükümə o şəxs qoyubdur. Yəni siz də o şeyləri oğurlamışdınız.” Ondan sonra bir-birilərinə

قَالُوٓا اِنْ يَسْرِقْ فَقَدْ سَرَقَ اَخٌ لَهُ مِنْ قَبْلُ ۚ فَاَسَرَّهَا يُوسُفُ فٖي نَفْسِهٖ وَلَمْ يُبْدِهَا لَهُمْ قَالَ اَنْتُمْ شَرٌّ
مَكَانًاۚ وَاللّٰهُ اَعْلَمُ بِمَا تَصِفُونَ ﴿٧٧﴾

---

dedilər: "Oğurluq bunların köhnə sənətləridir, bunun qardaşı Yusif də oğurluq etmişdi." Bu əhvalat belə olmuşdu: Yusif uşaqkən əmisinin yanında olurdu, bir qədər böyüyəndən sonra Yaqub onu əmisindən almaq istəyəndə əmisi razı olmadı. İshaqdan yadigar qalan bir kəməri onun libasının altından belinə bağladı. Yaqub Yusifi aparandan sonra gedib Yaquba dedi ki, o, oğurluq edibdir. Kəmər tapılanda Yusifi aparıb etdiyi oğurluğun əvəzində onu yanında saxladı. Qardaşları bu əhvalata əsasən Yusifə oğurluq isnad edib, tənə etdilər. Necə ki sıradakı ayədə xəbər verir)**.**

**77)** (قَالُوٓا اِنْ يَسْرِقْ فَقَدْ سَرَقَ اَخٌ لَهُ مِنْ قَبْلُ) – (bir-birilərinə) **dedilər: "Əgər bu** (Bünyamin) **oğurluq edibsə də,** (ona eyib deyil)**, çünki bunun qardaşı** (Yusif də) **bundan qabaq oğurluq etmişdi."** (فَاَسَرَّهَا يُوسُفُ فٖي نَفْسِهٖ وَلَمْ يُبْدِهَا لَهُمْ قَالَ اَنْتُمْ شَرٌّ مَكَانًا وَاللّٰهُ اَعْلَمُ بِمَا تَصِفُونَ) **- Yusif** (oğurluq isnadını eşidib)**, onu içində gizlədib, onlara izhar etməyib** (ürəyində) **dedi: "Sizin** (oğurluqdakı) **məqamınız daha yamandır,** (hansı ki məni oğurlayıb satmışdınız)**, Allah-Təala** (mənə və qardaşıma) **aid etdiyiniz sözlərdən agahdır."** (Elə ki, oğurluqları məlum oldu, Yusif dedi: "Mən sizə əvvəlcə də demişdim ki, siz oğru və casuslara bənzəyirsiniz, siz inkar etmişdiniz, indi mənim fərasətimi gördünüz?" Ondan sonra baxıcısını çağırıb dedi: "Bu camdan bunların əməllərini soruş, bunların əməllərini xəbər versin." Baxıcı dırnağıyla cama vurub, ona qulaq asıb dedi: "Cam deyir ki, bu oğurluq onların ilk əməli deyil. Bəlkə bundan qabaq da bir cavanı oğurlayıb satıblar." Yusif dedi: "Soruş gör, başqa nə əməlləri var." Baxıcı yenə dırnağıyla cama vurub, ona qulaq asıb dedi: "Ey vəzir, cam deyir ki, bunların qardaşımızı qurd yeyib həlak oldu sözü yalandır." Qardaşları bir qərib yerdə salamatdır, çox keçməz ki, peyda olub onlara etdikləri əməllərini xəbər verər. Ey vəzir, cam yenə deyir ki, yer üzündə bunlardan daha yalançı biri yoxdur, atalarına da yalan deyiblər. O yalandan tövbə etməyib, Allah-Təala da onları bağışlamayıbdır. Bunların atasına da nə müsibət üz veribsə, bunların yaman əməllərinin səbəbinə olubdur. Heç vaxt ataları bunlardan razı olmayıbdır." Yusifin qardaşları baxıb gördülər ki, cam onları rüsvay edib, hər bir elədiyi əməllərini bəyan edəcəkdir. Gəlib Yusifin başından və ayaqlarından öpüb dedilər: "Səni Allah-Təalaya and veririk, bundan artıq camdan heç nə soruşma." Ondan sonra Yusif dedi: "Siz gedin, gərək, Bünyamin öz əməlinin cəzasına görə burada qalsın." Onlar dedilər: "Ey vəzir, atamız qoca bir kişidir, ona vəd etmişik ki, gərək Bünyamini aparaq." Yusif razı olmadı, arada çox söz-söhbət oldu. Rubin qəzəblənib qardaşlarına dedi: "Misirin neçə bazarı var?" Dedilər: "10". Dedi: "Ya siz 9 nəfər bazarları qoruyun, mən təkcə padşahın

قَالُوا يَآ اَيُّهَا الْعَزِيزُ اِنَّ لَهُ اَبًا شَيْخًا كَبِيرًا فَخُذْ اَحَدَنَا مَكَانَهُ ۚ اِنَّا نَرٰيكَ مِنَ الْمُحْسِنِينَ ﴿٧٨﴾ قَالَ مَعَاذَ اللّٰهِ اَنْ نَأْخُذَ اِلَّا مَنْ وَجَدْنَا مَتَاعَنَا عِنْدَهُ ۙ اِنَّآ اِذًا لَظَالِمُونَ ۚ ﴿٧٩﴾ فَلَمَّا اسْتَيْـَٔسُوا مِنْهُ خَلَصُوا نَجِيًّا ۖ قَالَ كَبِيرُهُمْ اَلَمْ تَعْلَمُوٓا اَنَّ اَبَاكُمْ قَدْ اَخَذَ عَلَيْكُمْ مَوْثِقًا مِنَ اللّٰهِ

---

özünün və qoşununun qarşısında durum, ya da siz padşahın qarşısında durun, mən təkcə bazarları qoruyum.” Ondan sonra dedi: “Ey vəzir, qardaşımızı bizə ver, yoxsa burada elə səs-küy salarıq ki, Misirdə olan hamilə qadınların hamısı uşaqlarını salarlar.” Bu sözü deyərkən tükləri tikan kimi olmuşdu. Yusifin yanında oğlu Mişa durmuşdu. Oğluna işarə etdi ki, get Rubinin yanında dayanıb əlini onun bədəninə vur ki, qəzəbi soyusun. Yaqubun oğulları qəzəblənəndə qardaşlarından birinin əli onlara dəysəydi, sakitləşərdilər. Mişa gedib Rubinin xəbəri olmadan əlini onun bədəninə vurdu, Rubin də sakitləşdi. Rubin dedi: “Yəqin burada da Yaqubun nəslindən biri var.” Ondan sonra yenə Yusif Bünyamini saxlamaqda israr etdi. Rubin təkrar qəzəblənəndə Yusif Rubinin qollarından yapışıb, götürüb onu yerə çırpdı. Dedi: “Siz yəhudilər özünüzdən qüvvətli şəxs tanımırsınız.” Yusifdə bu qüvvəti görəndə hamısı zəlil olub, Bünyaminə görə başladılar Yusifə yalvarmağa. Necə ki ayədə buyurur).

**78)** (قَالُوا يَآ اَيُّهَا الْعَزِيزُ اِنَّ لَهُ اَبًا شَيْخًا كَبِيرًا) - (Yusifə) **dedilər: “Ey** (Misirin) **əzizi, həqiqətən,** (Bünyaminin) **çox qoca** (və hörmətli) **bir atası var.** (فَخُذْ اَحَدَنَا مَكَانَهُ) – (onu burax atasının yanına getsin)**, onun əvəzinə bizdən birini tutub saxla.** (اِنَّا نَرٰيكَ مِنَ الْمُحْسِنِينَ) **- həqiqətən, biz sənin yaxşı əməl sahiblərindən olduğunu görürük.** (Bizə yaxşılıq edib, onu azad et)**.”**

**79)** (قَالَ مَعَاذَ اللّٰهِ اَنْ نَأْخُذَ اِلَّا مَنْ وَجَدْنَا مَتَاعَنَا عِنْدَه) – (Yusif) **dedi: “Allah-Təalaya pənah aparıram,** (yox, heç vaxt olmaz, sizin öz fitvanıza görə, gərək mən o şəxsi tutub saxlayam ki, cam onun yükündən tapılıb)**. Malımızı kimdə tapmışıqsa, ancaq onu tutub saxlayacağıq.** (اِنَّآ اِذًا لَظَالِمُونَ) – (başqasını tutub saxlasaq)**, həqiqətən, zalımlardan olarıq.”**

**80)** (فَلَمَّا اسْتَيْـَٔسُوا مِنْهُ) - (Bünyamini Yusifdən almaqdan) **ümidlərini kəsdikdə,** (خَلَصُوا نَجِيًّا) – **kənara çəkilib,** (bir-biriləri ilə) **gizli** (məşvərət edib) **dedilər: “Bu nə bəladır bizə gəldi? Bu padşah heç kimə etmədiyini bizə etdi, bəlkə, bunun Yusifin əhvalatından xəbəri var? Bunun bizimlə bu cür rəftar etməsi çox təəccüblüdür.” Yəhuda dedi: “Məncə bu elə Yusifin özüdür.” Dedilər: “Yusif necə gəlib belə məqama çatdı? İndi nə çarə edək? Biz atamıza vəd etmişik ki, Bünyamini aparaq. Bu vəzir də onu verən deyil. Böyük bəlaya düşdük. Əgər ona desək ki, Bünyamini etdiyi oğurluğa görə saxlayıblar, atamız bizim bu sözümüzü qəbul etməz.”** (قَالَ كَبِيرُهُمْ اَلَمْ تَعْلَمُوٓا اَنَّ اَبَاكُمْ قَدْ اَخَذَ عَلَيْكُمْ مَوْثِقًا مِنَ اللّٰهِ) **- onların böyükləri** (Rubin) **dedi: “Bəs atanızın** (Bünyamini qaytarasınız deyə) **sizə Allah-Təalaya and içdirib əhd**

وَمِنْ قَبْلُ مَا فَرَّطْتُمْ فِي يُوسُفَ ۚ فَلَنْ اَبْرَحَ الْاَرْضَ حَتّٰى يَأْذَنَ لِٓي اَبِٓي اَوْ يَحْكُمَ اللّٰهُ لِيۚ وَهُوَ خَيْرُ
الْحَاكِمِينَ ﴿٨٠﴾ اِرْجِعُوٓا اِلٰٓى اَبِيكُمْ فَقُولُوا يَٓا اَبَانَٓا اِنَّ ابْنَكَ سَرَقَۚ وَمَا شَهِدْنَٓا اِلَّا بِمَا عَلِمْنَا وَمَا كُنَّا
لِلْغَيْبِ حَافِظِينَ ﴿٨١﴾ وَسْـَٔلِ الْقَرْيَةَ الَّتِي كُنَّا فِيهَا وَالْعِيرَ الَّتِٓي اَقْبَلْنَا فِيهَاۜ وَاِنَّا لَصَادِقُونَ ﴿٨٢﴾ قَالَ بَلْ
سَوَّلَتْ لَكُمْ اَنْفُسُكُمْ اَمْرًاۜ فَصَبْرٌ جَمِيلٌۜ عَسَى اللّٰهُ اَنْ يَأْتِيَنِي بِهِمْ جَمِيعًاۜ اِنَّهُ هُوَ الْعَلِيمُ الْحَكِيمُ ﴿٨٣﴾

---

**aldığını bilmirsiniz?”** (وَمِنْ قَبْلُ مَا فَرَّطْتُمْ فِي يُوسُفَ) **- və bundan qabaq Yusif haqqında elədiyiniz təqsiri** (bilmirsiniz? Bu şəkildə necə qayıdıb atamızın yanına gedək?) (فَلَنْ اَبْرَحَ الْاَرْضَ حَتّٰى يَأْذَنَ لِٓي اَبِي) **- atam mənə izin verib yanına çağırana qədər mən əsla** (Misir) **torpağından çıxmaram,** (اَوْ يَحْكُمَ اللّٰهُ لِي) **- ya da Allah-Təala** (qardaşımı mənə qaytarmaq barəsində) **bir hökm verməyənə qədər** (Misirdən ayrılmaram). (وَهُوَ خَيْرُ الْحَاكِمِينَ) **- Allah-Təala hökm edənlərin yaxşısıdır.** (Çünki ədalət üzrə hökm edər)**.**

**81)** (اِرْجِعُوٓا اِلٰٓى اَبِيكُمْ) **- indi siz qayıdıb atanızın yanına gedin,** (فَقُولُوا يَٓا اَبَانَٓا اِنَّ ابْنَكَ سَرَقَ) **– deyin ki, həqiqətən, oğlun** (Bünyamin) **oğurluq etdi.** (Bu səbəbdən Misr padşahı onu tutub saxladı)**.** (وَمَا شَهِدْنَٓا اِلَّا بِمَا عَلِمْنَا) **- biz ancaq bildiyimizə şəhadət etdik.** (Gözümüzlə gördük ki, camı onun yükündən çıxartdılar)**.** (وَمَا كُنَّا لِلْغَيْبِ حَافِظِينَ) – (zahirdə biz camın onun yükündən çıxdığını gördük)**, amma işin batininə mühafiz deyilik.** (yəni həqiqətən Bünyamin oğurluq edib, yoxsa hiylə ilə camı onun yükünə qoyublar, bunu bilmirik)**.**

**82)** (وَسْـَٔلِ الْقَرْيَةَ الَّتِي كُنَّا فِيهَا) **- ey ata, içində olduğumuz** (Misir) **şəhərinin** (əhlinə adam göndərib) **bu əhvalatı soruş.** (وَالْعِيرَ الَّتِٓي اَقْبَلْنَا فِيهَا) **- və içində gəldiyimiz karvanın** (əhlindən də soruş)**.** (وَاِنَّا لَصَادِقُونَ) **- həqiqətən, biz** (bu sözümüzdə) **doğruyuq.** (Rubin bu sözləri qardaşlarına öyrədib, onları Kənana yola salıb, özü Misirdə qaldı. Qardaşları gedib Bünyaminin əhvalatını atalarına nəql etdilər. Ataları onların sözlərini qəbul etməyib rədd etdi)**.**

**83)** (قَالَ بَلْ سَوَّلَتْ لَكُمْ اَنْفُسُكُمْ اَمْرًا) – (Yaqub) **dedi: “Xeyr,** (dediyiniz kimi deyil, Bünyamin oğurluq edən deyildir)**. Bəlkə, nəfsiniz** (etdiyiniz) **bu işi sizə gözəl göstərdi.** (Misirdə qardaşınıza oğurluq isnad edib, dünya mənfəəti qazandınız, əgər siz deməsəydiniz, Misir padşahı haradan bilərdi ki, oğurluq əvəzinə oğrunu tutub saxlamaq lazımdır? Bunlar hamısı sizin hiylənizdir. Bundan qabaq Yusifə hiylə etdiniz, indi də qardaşına)**.** (فَصَبْرٌ جَمِيلٌ) **- indi mənə gözəl səbir etmək** (lazımdır ki, heç kimdən şikayət etməyim)**.** (عَسَى اللّٰهُ اَنْ يَأْتِيَنِي بِهِمْ جَمِيعًا) **- Allah-Təaladan ümidim budur ki, onların hamısını** (Yusifi, Bünyamini, Rubini) **mənə yetirib** (məni bu qəm-qüssədən xilas etsin)**.** (اِنَّهُ هُوَ الْعَلِيمُ الْحَكِيمُ) **- həqiqətən, Allah-Təala** (mənim hüzn və qüssəmdən) **agahdır. Öz hikməti üzrə** (məni bu bəlalara düçar edibdir)**.**

وَتَوَلّٰى عَنْهُمْ وَقَالَ يَآ اَسَفٰى عَلٰى يُوسُفَوَابْيَضَّتْ عَيْنَاهُ مِنَ الْحُزْنِ فَهُوَ كَظِيمٌ ﴿٨٤﴾ قَالُوا تَاللّٰهِ تَفْتَؤُا
تَذْكُرُ يُوسُفَ حَتّٰى تَكُونَ حَرَضًا اَوْ تَكُونَ مِنَ الْهَالِكِينَ ﴿٨٥﴾ قَالَ اِنَّمَآ اَشْكُوا بَثّ۪ي وَحُزْن۪ٓي اِلَى اللّٰهِ
وَاَعْلَمُ مِنَ اللّٰهِ مَا لَا تَعْلَمُونَ ﴿٨٦﴾ يَا بَنِيَّ اذْهَبُوا فَتَحَسَّسُوا مِنْ يُوسُفَ وَاَخ۪يهِ وَلَا تَا۬يْـَٔسُوا مِنْ رَوْحِ
اللّٰهِ اِنَّهُ لَا يَا۬يْـَٔسُ مِنْ رَوْحِ اللّٰهِ اِلَّا الْقَوْمُ الْكَافِرُونَ ﴿٨٧﴾ فَلَمَّا دَخَلُوا عَلَيْهِ قَالُوا يَآ اَيُّهَا الْعَز۪يزُ مَسَّنَا
وَاَهْلَنَا الضُّرُّ وَجِئْنَا بِبِضَاعَةٍ مُزْجٰيةٍ فَاَوْفِ لَنَا الْكَيْلَ وَتَصَدَّقْ عَلَيْنَاۜ اِنَّ اللّٰهَ يَجْزِي الْمُتَصَدِّق۪ينَ ﴿٨٨﴾

---

**84)** (وَتَوَلّٰى عَنْهُمْ) - (Yaqub oğullarının sözlərindən xoşlanmadığından) **onlardan üz döndərib,** (وَقَالَ يَآ اَسَفٰى عَلٰى يُوسُفَ) **- dedi: “Heyif Yusifə,** (hüzn və qəmim artdı), (وَابْيَضَّتْ عَيْنَاهُ مِنَ الْحُزْنِ فَهُوَ كَظِيمٌ) – (oğullarına olan) **qəzəbini,** (Yusif üçün olan) **hüznünü içində saxlayıb** (ağlamaqdan) **gözləri ağardı.**

**85)** (قَالُوا تَاللّٰهِ تَفْتَؤُا تَذْكُرُ يُوسُفَ) – (oğulları) **dedilər: “**(Ey ata)**, and olsun Allah-Təalaya Yusifi yad etməkdən,** (onun məhəbbətindən) **kənar ol,** (حَتّٰى تَكُونَ حَرَضًا) **- yoxsa** (Yusifi yad etməkdən) **ağlını itirər,** (اَوْ تَكُونَ مِنَ الْهَالِكِينَ) **- ya da həlak olub ölənlərdən olarsan.”**

**86)** (قَالَ اِنَّمَآ اَشْكُوا بَثّ۪ي وَحُزْن۪ي اِلَى اللّٰهِ) **- dedi: “**(Mənim sizə bir şikayətim yoxdur)**, həqiqətən, mən şiddətli qəm və hüznümü ancaq Allah-Təalaya ərz edib** (Ondan başqasına şikayət edən deyiləm). (وَاَعْلَمُ مِنَ اللّٰهِ مَا لَا تَعْلَمُونَ) **- mən sizin bilmədiyinizə, Allah-Təalanın** (lütf və rəhmətinə) **agaham,** (əlbəttə, məndən ötrü bir nicat olacaqdır)**.**

**87)** (يَا بَنِيَّ اذْهَبُوا فَتَحَسَّسُوا مِنْ يُوسُفَ وَاَخ۪يهِ) **-** (Yaqub Yusifin həyatından ümidsiz olmayıb oğullarına onu axtarmağı əmr edib deyir:) **ey mənim oğullarım,** (Misirə) **gedib Yusif və qardaşı** (Bünyamini) **axtarıb** (bir xəbər alın). (وَلَا تَا۬يْـَٔسُوا مِنْ رَوْحِ اللّٰهِ) **- Allah-Təalanın qəm və qüssə açan fərəhindən ümidinizi kəsməyin.** (اِنَّهُ لَا يَا۬يْـَٔسُ مِنْ رَوْحِ اللّٰهِ اِلَّا الْقَوْمُ الْكَافِرُونَ) **- həqiqətən, kafir camaatdan başqası Allah-Təalanın nicat və** (rəhmətindən) **ümidini kəsməz.”**

**88)** (فَلَمَّا دَخَلُوا عَلَيْهِ) – (Yaqubun oğulları qayıdıb üçüncü dəfə Misirə getdilər. Yusifin) **hüzuruna daxil olduqda,** (قَالُوا يَآ اَيُّهَا الْعَز۪يزُ) **- dedilər: “Ey** (Misirin) **vəziri,** (مَسَّنَا وَاَهْلَنَا الضُّرُّ)– (aclığın şiddətindən) **bizə və ailəmizə zəiflik üz verdi.** (وَجِئْنَا بِبِضَاعَةٍ مُزْجٰيةٍ) **- az** (və əskik) **olan malla gəlmişik,** (hansı ki o malı alan şəxs gərək bizə güzəşt edib onu qəbul etsin). (فَاَوْفِ لَنَا الْكَيْلَ) **- bizə bundan qabaq verdiyin kimi ərzağı ölçü ilə düz verib** (bəxş elə). (وَتَصَدَّقْ عَلَيْنَا) **- bizə lütf edib,** (az olan məbləğə çox ərzaq ver). (اِنَّ اللّٰهَ يَجْزِي الْمُتَصَدِّق۪ينَ) **- həqiqətən, Allah-Təala lütf edənlərə mükafat verər.** (Yusif bu mətləbi eşidəndə daha özünü saxlaya bilməyib dedi: “Ey Yaqubun oğulları, lütf edib güzəşt etmək yaxşı, gözəl şeydirmi? Bəs siz niyə Yusifə güzəşt etmədiniz? Halbuki heç bir günahın sahibi də deyildi)**.”**

قَالَ هَلْ عَلِمْتُمْ مَا فَعَلْتُمْ بِيُوسُفَ وَاَخِيهِ اِذْ اَنْتُمْ جَاهِلُونَ ﴿٨٩﴾ قَالُوٓا ءَاِنَّكَ لَاَنْتَ يُوسُفُ ۜ قَالَ
اَنَا يُوسُفُ وَهٰذَٓا اَخِيۘ قَدْ مَنَّ اللّٰهُ عَلَيْنَاۜ اِنَّهُ مَنْ يَتَّقِ وَيَصْبِرْ فَاِنَّ اللّٰهَ لَا يُضِيعُ اَجْرَ الْمُحْسِنِينَ ﴿٩٠﴾
قَالُوا تَاللّٰهِ لَقَدْ اٰثَرَكَ اللّٰهُ عَلَيْنَا وَاِنْ كُنَّا لَخَاطِئِينَ ﴿٩١﴾ قَالَ لَا تَثْرِيبَ عَلَيْكُمُ الْيَوْمَۜ يَغْفِرُ اللّٰهُ لَكُمْۘ
وَهُوَ اَرْحَمُ الرَّاحِمِينَ ﴿٩٢﴾

---

**89)** (قَالَ هَلْ عَلِمْتُمْ مَا فَعَلْتُمْ بِيُوسُفَ وَاَخِيهِ اِذْ اَنْتُمْ جَاهِلُونَ) - (Yusif) **dedi: "Cahilkən Yusifə etdiyiniz əməllərin qəbahətini bilib** (ondan tövbə etdinizmi? Yusifin ucalığını buradan bilmək olur. Belə bir məqamda, özü də iqtidar sahibi olub, ona zülm edən qardaşları da onun hüzurunda durduğu halda, gərək onlara qəzəblənib, intiqam alaydı. Onun əvəzinə gör onlara nə deyir: deyirsiniz ki, Yusifə etdiyiniz zülmü cəhalətdən edibsiniz, bəs belə qəbih əməldən tövbə edib Allah-Təalaya döndünüzmü? Çünki hər bir qəbih əməldən tövbə etmək lazımdır. Bundan artıq nə güzəşt etmək olar? Şəfqət və lütfün son mərtəbəsidir. Yusifin qardaşları ondan bu sözləri eşidəndən sonra bildilər ki, bu Yusifdir)**.**

**90)** (قَالُوٓا ءَاِنَّكَ لَاَنْتَ يُوسُفُ) **- dedilər: "Həqiqətən, sən Yusifsənmi?** (قَالَ اَنَا يُوسُفُ وَهٰذَٓا اَخِي) **- dedi: bəli mən Yusifəm. Bu da mənim qardaşım** (Bünyamindir, məndən ayrıldığından narahat idi)**.** (قَدْ مَنَّ اللّٰهُ عَلَيْنَا) **- həqiqətən, Allah-Təala bizə lütf edib** (nemətlərini tamam edib, bizi sağ-salamat bir yerə topladı)**.** (اِنَّهُ مَنْ يَتَّقِ وَيَصْبِرْ) **- həqiqətən, kim ki, Allah-Təaladan qorxub, hər bir möhnətə səbir etsə,** (necə ki mən səbir etdim)**,** (فَاِنَّ اللّٰهَ لَا يُضِيعُ اَجْرَ الْمُحْسِنِينَ) **- həqiqətən, Allah-Təala** (səbir edib) **yaxşı əməl edənlərin əcrini zay etməz.**

**91)** (قَالُوا تَاللّٰهِ لَقَدْ اٰثَرَكَ اللّٰهُ عَلَيْنَا) – (qardaşları) **dedilər: Allah-Təalaya and olsun, həqiqətən, Allah səni** (səbir, təqva və gözəl əməllər səbəbinə) **bizə üstün edib,** (səltənət sahibi etdi)**.** (وَاِنْ كُنَّا لَخَاطِئِينَ) **- həqiqətən,** (Allah-Təaladan qorxmayıb, pis əməl edib, qəsdən) **günahkar olduğumuz üçün** (Allah-Təala bizi zəlil edib səni əziz, hörmətli etdi)**.**

**92)** (قَالَ لَا تَثْرِيبَ عَلَيْكُمُ الْيَوْمَ) – (Yusif) **dedi: "Bugünkü gündə mənim tərəfimdən sizə heç bir məzəmmət və töhmət yoxdur.** (يَغْفِرُ اللّٰهُ لَكُمْ)**- Allah-Təala sizi bağışlayar.** (وَهُوَ اَرْحَمُ الرَّاحِمِينَ) **- rəhm edənlərin ən mərhəmətlisi Allah-Təaladır.** (Daha bundan artıq nə mərhəmət ola bilər? Onu öldürməyə çalışan qardaşlarını məzəmmət də etməyib, onlardan ötrü Allah-Təaladan bağışlanma diləyir. Hz. Peyğəmbər Məkkəni fəth edib ora daxil olanda onun qətlinə əmr verən Qüreyş əyanları qorxularından Kəbənin içinə sığındılar. Hz. Peyğəmbər gedib Kəbənin qapısının iki tərəfindən tutub dedi: "Nə düşünürsünüz, sizə nə edəcəyəm?" Dedilər: "Yaxşılıq edəcəyini güman edirik, kərim (möhtərəm) qardaş və kərim olan qardaş oğlusan, indi bizdən qüdrətlisən, günahımızdan keç." Hz. Peyğəmbər buyurubdur: "Mən sizə o sözü deyirəm ki, qardaşım

اِذْهَبُوا بِقَم۪يص۪ي هٰذَا فَاَلْقُوهُ عَلٰى وَجْهِ اَب۪ي يَأْتِ بَص۪يرًاۚ وَأْتُون۪ي بِاَهْلِكُمْ اَجْمَع۪ينَ ﴿٩٣﴾ وَلَمَّا
فَصَلَتِ الْع۪يرُ قَالَ اَبُوهُمْ اِنّ۪ي لَاَجِدُ ر۪يحَ يُوسُفَ لَوْلَٓا اَنْ تُفَنِّدُونِ ﴿٩٤﴾ قَالُوا تَاللّٰهِ اِنَّكَ لَف۪ي
ضَلَالِكَ الْقَد۪يمِ ﴿٩٥﴾ فَلَمَّٓا اَنْ جَٓاءَ الْبَش۪يرُ اَلْقٰيهُ عَلٰى وَجْهِه۪ فَارْتَدَّ بَص۪يرًاۚ

---

Yusif qardaşlarına demişdi: “Bugünkü gündə sizə heç bir məzəmmət yoxdur, Allah-Təala sizi bağışlayar, gedin, mən sizi azad etdim.” (Əhməd bin Hənbəl, Müsnəd, 3/183; IV/396; V/220) Yusifin qardaşları onu tanıdıqdan sonra Yusif onları yenə yeməyə dəvət etdikdə dedilər: “Daha bizi yeməyə çağırma, etdiyimiz əməllərə görə səndən utanırıq.” Yusif dedi: “Hərçənd mən Misirə hakim olmuşam, amma onlar mənə yenə ilk dəfə olduğu kimi baxıb deyirlər: “Allah-Təala bir qulamı belə böyük bir mərtəbəyə yetirməyə qadirdir,” -sizin bura gəlməyiniz və mənim qardaşım olmanız xalqa məlum olanda məni onların gözündə daha da böyüdüb belə deyərlər: “Bu Yusif İbrahimin övladıdır, belə qardaşları var, sizin səbəbinizə mən xalqın gözündə daha da yüksələrəm.” Bəli, insaf sahibindən belə sözlər meydana gələr)**.**

**93)** (اِذْهَبُوا بِقَم۪يص۪ي هٰذَا) – (ondan sonra Yusif qardaşlarını çağırıb) **dedi: “Gəlin mənim bu köynəyimi aparın** (atamın yanına)**.** (فَاَلْقُوهُ عَلٰى وَجْهِ اَب۪ي يَأْتِ بَص۪يرًا) **- köynəyimi atamın üzünə salın ki, gözləri yenidən görsün.** (وَأْتُون۪ي بِاَهْلِكُمْ اَجْمَع۪ينَ) **- ondan sonra** (atam Yaqubla və) **bütün ailənizlə** (birlikdə) **yanıma gəlin.** (Yəhuda dedi: “Birinci dəfə qanlı köynəyi mən aparıb, atamı məhzun və qəmgin etmişəm, indi yenə bu köynəyi mən aparıb atamı şad edəcəyəm.” Köynəyi götürüb yola düşdü)**.**

**94)** (وَلَمَّا فَصَلَتِ الْع۪يرُ) **-** (Yusifin köynəyi ilə birlikdə) **karvan** (Misirdən) **çıxdıqda,** (قَالَ اَبُوهُمْ) **- ataları** (Yaqub Kənanda olan nəvələrinə və camaata) **dedi:** (اِنّ۪ي لَاَجِدُ ر۪يحَ يُوسُفَ لَوْلَٓا اَنْ تُفَنِّدُونِ) **- “Əgər məni ağılsız saymasanız, həqiqətən, mən Yusifin iyini** (ətrini) **alıram,** (Yusifin ətri gəlir)**.”***

*(*__Qeyd:__ Eşq və məhəbbət aləmi ayrı aləmdir, onu eşqə düşənlər bilirlər, aşiq nəinki Misirdən, hətta məğribdən məşriqə məşuqəsinin iyini duyar. Necə ki Məcnun uca dağların arxasında oturub deyirdi: “Ey Nəcdin dağları, mənimlə məhbubumun arasında dayanmayın. Qoyun Leylinin ətri mənə gəlsin.” İstədilər ondan qan alsınlar, damarına neştər vursunlar. Dedi: “O, Leylinin damarıdır, ora necə neştər vurarsan?” Aşiqlərin qəribə əhvalatlarını sayıb qurtarmaq olmaz. Bir şəxsin ki, Yusifin ayrılığı səbəbilə ağlamaqdan gözləri kor olsun, Yusifin köynəyinin iyini Misirdən çıxan karvandan alması təəccüblü deyil).*

**95)** (قَالُوا تَاللّٰهِ اِنَّكَ لَف۪ي ضَلَالِكَ الْقَد۪يمِ) **-** (onlar Yusifi ölü zənn etdiklərindən) **dedilər: “And olsun Allah-Təalaya, sən** (Yusifi həmişə yad edib ona olan sevginin çoxluğundan) **köhnə xətanda qalmısan.**

**96)** (فَلَمَّٓا اَنْ جَٓاءَ الْبَش۪يرُ) – (Yusifin köynəyini gətirib) **müjdə verən** (Yəhuda) **gəldikdə,** (اَلْقٰيهُ عَلٰى وَجْهِه۪ فَارْتَدَّ بَص۪يرًا) – (Yusifin köynəyini atası Yaqubun) **üzünə**

قَالَ اَلَمْ اَقُلْ لَكُمْ اِنِّيٓ اَعْلَمُ مِنَ اللّٰهِ مَا لَا تَعْلَمُونَ ﴿٩٦﴾ قَالُوا يَآ اَبَانَا اسْتَغْفِرْ لَنَا ذُنُوبَنَآ اِنَّا كُنَّا خَاطِئِينَ ﴿٩٧﴾ قَالَ سَوْفَ اَسْتَغْفِرُ لَكُمْ رَبِّيٓ اِنَّهُ هُوَ الْغَفُورُ الرَّحِيمُ ﴿٩٨﴾

---

**saldı,** (Yaqubun) **gözləri dərhal açıldı.** (قَالَ اَلَمْ اَقُلْ لَكُمْ اِنِّيٓ اَعْلَمُ مِنَ اللّٰهِ مَا لَا تَعْلَمُونَ) **-** (Yaqub) **dedi: bəs mən sizə demədim ki, həqiqətən, sizin bilmədiyinizi mən bilirəm,** (mənim Yusifim həyatdadır Allah-Təala bizi bir yerə gətirəcəkdir. Hz. Yaqub səhər namazından sonra belə deyərdi: "İlahi, Yusifi mənə bağışlayıb məni Yusifə qovuşdur." Axırda Allah-Təala onun duasını qəbul edib onu Yusifə qovuşdurdu. Övladını da bağışladı. Nə gözəl deyir şair:

*Səhərdə gül kimi baş aç, təzərrö eylə məbuda,*
*Duayi-sübh baisdir, kilidi babi-maqsuda*

(Səhər gül kimi açılıb tanrıya yalvar, sübh duası məqsəd qapısının kilidinin açılmasına səbəbdir).

Ondan sonra Yusifin digər qardaşları da gəlib arxadan yetişdilər)**.**

**97)** (قَالُوا يَآ اَبَانَا اسْتَغْفِرْ لَنَا ذُنُوبَنَآ اِنَّا كُنَّا خَاطِئِينَ) (Yaqubun övladı atalarının yanına yığışıb) **dedilər: "Ey bizim atamız,** (bizim Yusif barəsində etdiyimiz) **günahlardan ötrü Allahdan bağışlanmamızı dilə. Həqiqətən, biz günahkar olduq."**

**98)** (قَالَ سَوْفَ اَسْتَغْفِرُ لَكُمْ رَبِّيٓ اِنَّهُ هُوَ الْغَفُورُ الرَّحِيمُ) – (Yaqub) **dedi:** (tezliklə Yusiflə görüşəndən sonra) **sizdən ötrü öz rəbbimdən bağışlanma diləyəcəm. Həqiqətən, mənim rəbbim** (tövbə edənləri) **bağışlayıb rəhm edəndir.** (Yəhuda köynəyi atası Yaqubun üzünə salıb gözləri açıldıqda, Yəhuda dedi: "Ey ata, Misirin ixtiyar sahibi və vəziri sənin oğlun Yusifdir." Yaqub dedi: "Mənə səltənət lazım deyil. Yusifi hansı dində qoyub gəlibsən?" Dedi: "Atası İbrahimin dinində." Dedi: "İndi Allahın neməti tamam oldu." Yəhuda dedi: "Oğlun Yusif səfər tədarükü və 200 heyvanı bizi nəql etməkdən ötrü göndəribdir. Özün və bütün ailən gərək Misirə gedəsiniz." Yaqub əmr etdi ki, getməkdən ötrü tədarük görsünlər. Kənandan çıxıb Misirə yola düşdülər. Yaqub Misirə yaxınlaşdıqca Yusifə olan həsrəti, şövqü daha da artırdı. Misirə yaxınlaşanda Yusifə xəbər verdilər ki, atan gəldi. 3 min nəfərlə atasını qarşılamağa çıxıb səhrada düzüldülər. Yaqub bir təpənin üstünə çıxıb səhranın bəzəkli süvarilərlə dolu olduğunu gördü. Yəhudaya söykənib durduğu halda, təəccüblə onlara baxıb dedi: "Ey Yəhuda, bu, Misir fironunundur?" Yəhuda dedi: "Oğlun Yusifindir." Bir-birilərinə yaxınlaşıb qarşılaşanda Yaqub dedi: "Salam olsun sənə ey hüzn və qəmləri dağıdan Yusif", ondan sonra qucaqlaşıb, fərəh və sevincdən ağladılar. Ondan sonra istirahət etməkdən ötrü Yusifin əmri ilə səhrada qurulan çadırlara daxil oldular. Necə ki Allah-Təala gələn ayədə xəbər verir, Yaqub Misirə daxil olanda kişi, qadın bütün ailəsi 72 nəfər idi. Yaqubun Misirə

**فَلَمَّا دَخَلُوا عَلٰى يُوسُفَ اٰوٰىٓ اِلَيْهِ اَبَوَيْهِ وَقَالَ ادْخُلُوا مِصْرَ اِنْ شَٓاءَ اللّٰهُ اٰمِنِينَۜ ﴿٩٩﴾ وَرَفَعَ اَبَوَيْهِ عَلَى الْعَرْشِ وَخَرُّوا لَهُ سُجَّدًاۚ وَقَالَ يَٓا اَبَتِ هٰذَا تَأْوِيلُ رُءْيَايَ مِنْ قَبْلُۘ قَدْ جَعَلَهَا رَبِّي حَقًّاۜ وَقَدْ اَحْسَنَ بِٓي اِذْ اَخْرَجَنِي مِنَ السِّجْنِ وَجَٓاءَ بِكُمْ مِنَ الْبَدْوِ مِنْ بَعْدِ اَنْ نَزَغَ الشَّيْطَانُ بَيْنِي وَبَيْنَ اِخْوَتِيۜ اِنَّ رَبِّي لَطِيفٌ لِمَا يَشَٓاءُۜ اِنَّهُ هُوَ الْعَلِيمُ الْحَكِيمُ ﴿١٠٠﴾ رَبِّ قَدْ اٰتَيْتَنِي مِنَ الْمُلْكِ وَعَلَّمْتَنِي مِنْ تَأْوِيلِ الْاَحَادِيثِۚ فَاطِرَ السَّمٰوَاتِ وَالْاَرْضِ اَنْتَ وَلِيّ۪ فِي الدُّنْيَا وَالْاٰخِرَةِۚ تَوَفَّنِي مُسْلِمًا وَاَلْحِقْنِي بِالصَّالِحِينَ ﴿١٠١﴾**

---

gəlməsindən 216 il sonra Yaqubun Levi adlı oğlunun nəslindən olan Hz. Musa bəni-İsraili götürüb Misirdən çıxanda bəni-İsrail əhalisinin sayı bunun 4 qatı qədər idi. Allah-Təala İbrahimə verdiyi vədini - sənin övladlarını səmadakı ulduzlar qədər edəcəyəm, sözünü yerinə yetirdi)**.**

**99)** (فَلَمَّا دَخَلُوا عَلٰى يُوسُفَ)– (səhrada qurulan çadırlarda Yaqub və nəsli) **Yusifin hüzuruna daxil olduqda,** (اٰوٰىٓ اِلَيْهِ اَبَوَيْهِ) – (Yusif) **ata-anasını qucaqlayıb,** (çadırlarda rahatlandılar)**.** (وَقَالَ ادْخُلُوا مِصْرَ اِنْ شَٓاءَ اللّٰهُ اٰمِنِينَ) – (ondan sonra) **dedi: "İnşallah hər bir cəhətdən arxayın olduğunuz halda, Misirə daxil olun."**

**100)** (وَرَفَعَ اَبَوَيْهِ عَلَى الْعَرْشِ) – (Misirə daxil olandan sonra Yusif) **ata-anasına** (izzət və hörmət edib) **onları uca taxt üstündə oturtdu.** (وَخَرُّوا لَهُ سُجَّدًا) **- hamısı** (məclisdə oturandan sonra 11 qardaşı, atası və anası ehtiram göstərib) **ona səcdə etdilər.** (وَقَالَ يَٓا اَبَتِ هٰذَا تَأْوِيلُ رُءْيَايَ مِنْ قَبْلُ) - (Yusif) **dedi: "Ey ata, budur mənim yuxumun yozumu, hansı ki bundan qabaq** (uşaq vaxtı görmüşdüm)**.** (قَدْ جَعَلَهَا رَبِّي حَقًّا) **- həqiqətən, mənim rəbbim Allah-Təala** (o yuxunu) **həqiqət etdi.** (وَقَدْ اَحْسَنَ بِٓي اِذْ اَخْرَجَنِي مِنَ السِّجْنِ) **- həqiqətən, rəbbim Allah-Təala məni zindandan çıxarmaqla mənə ehsan etdi,** (وَجَٓاءَ بِكُمْ مِنَ الْبَدْوِ مِنْ بَعْدِ اَنْ نَزَغَ الشَّيْطَانُ بَيْنِي وَبَيْنَ اِخْوَتِي) **- şeytan mənimlə qardaşlarımın arasına fəsad salandan sonra Allah-Təala** (bizim aramızı düzəldib) **sizi çöldən** (Misirə) **gətirdi.** (اِنَّ رَبِّي لَطِيفٌ لِمَا يَشَٓاءُ) **- həqiqətən, mənim rəbbim Allah-Təala istədiyi şeyi dəqiq edəndir,** (اِنَّهُ هُوَ الْعَلِيمُ الْحَكِيمُ) **- həqiqətən, mənim rəbbim Allah-Təala hər bir şey agah və hikmət üzrə edəndir.**

**101)** (رَبِّ قَدْ اٰتَيْتَنِي مِنَ الْمُلْكِ) – (ondan sonra Yusif Allah-Təalanın ona verdiyi nemətləri sayıb dua edib dedi:) **"Ey mənim rəbbim, həqiqətən, sən mənə** (Misir) **mülkünü verdin.** (وَعَلَّمْتَنِي مِنْ تَأْوِيلِ الْاَحَادِيثِ) – (bəzi müşkül olan hikmətli) **kəlamların yozumunu mənə öyrətdin.** (فَاطِرَ السَّمٰوَاتِ وَالْاَرْضِ) **- səmaları və yeri yoxdan yaradan sənsən.** (اَنْتَ وَلِيّ۪ فِي الدُّنْيَا وَالْاٰخِرَةِ) **- mənim dünya və axirətdə köməyim** (və hər bir işimi idarə edən) **sənsən.** (تَوَفَّنِي مُسْلِمًا) – (sənə itaət edib müvəhhid) **müsəlman olduğum halda məni vəfat etdir.** (وَاَلْحِقْنِي بِالصَّالِحِينَ) **- və məni axirətdə saleh olan bəndələrinə qovuşdur.** (Yaqub oğlu Yusifin zamanında Misirdə 44 il yaşayandan sonra vəfat etdi. Yusif öz həkimlərinə əmr etdi, Yaqubun bədənini çürüyüb dağılmaqdan qorumaq üçün

ذٰلِكَ مِنْ اَنْبَٓاءِ الْغَيْبِ نُوح۪يهِ اِلَيْكَۚ وَمَا كُنْتَ لَدَيْهِمْ اِذْ اَجْمَعُوٓا اَمْرَهُمْ وَهُمْ يَمْكُرُونَ ﴿١٠٢﴾
وَمَٓا اَكْثَرُ النَّاسِ وَلَوْ حَرَصْتَ بِمُؤْمِن۪ينَ ﴿١٠٣﴾ وَمَا تَسْـَٔلُهُمْ عَلَيْهِ مِنْ اَجْرٍۜ اِنْ هُوَ اِلَّا ذِكْرٌ
لِلْعَالَم۪ينَ ۟ ﴿١٠٤﴾

---

balzam yağıyla mumiyalayıb, 40 gün saxladılar. O dövrdə Misirdə tibb elmi inkişaf etmişdi, bədəni mumiyalamaq adət idi, lakin bu 40 gün çəkərdi. Ondan sonra Yaqubun öz vəsiyyətinə görə, onu aparıb Kənanda, babası Hz. İbrahimin və atası İshaqın yanında dəfn etdilər. Hz. Yusif atasından sonra 23 il yaşayıb, 110 yaşında öz rəbbinə qovuşdu. Onun bədənini də atası kimi balzam yağıyla mumiyaladılar, onu harda dəfn etmək üstündə Misir əhli ixtilaf etdi, hər kəs onu öz məhəlləsində dəfn etmək istəyirdi. Axırda birləşib bir mərmər sandığın içində Misirə daxil olan Nil çayının bir dərəsinin altında onu dəfn etdilər ki, su onun üstündən gəlib keçməklə Misir əhli bərəkət və mənfəət əldə edə bilsin. Hz. Musa Misirdən çıxanda həmin mərmər sandıqda olan Yusifin cəsədini çaydan çıxarıb, aparıb Kənanda ata-babalarının qəbrinin yanında dəfn etdi)**.** (Mülk və həmd Allaha məxsusdur, O, hər bir şeyə qadir və müqəddəsdir)**.**

**102)** (ذٰلِكَ مِنْ اَنْبَٓاءِ الْغَيْبِ نُوح۪يهِ اِلَيْكَ) – (ey Məhəmməd, bu Yusif və qardaşlarının xəbəri) **qeyb xəbərlərindəndir. Sənə vəhy edib** (bildiririk)**.** (وَمَا كُنْتَ لَدَيْهِمْ اِذْ اَجْمَعُوٓا اَمْرَهُمْ وَهُمْ يَمْكُرُونَ) - (ey Məhəmməd, Yusifin qardaşları onu quyuya atmaq üçün) **əlbir olub, məkr və hiylə etdiklərində, sən onların yanında deyildin,** (sən ki bu əhvalat olanda o zaman olmayıbsan və heç bir kitabda da oxumayıb, heç bir kimsədən də eşitməyibsən. Necə ki bu müşriklər özləri iqrar edirlər. Bəs belə bir gözəl qissəni belə fəsahətli və bəlağətli Quran ayələrindən eşidib niyə iman etmirlər? Onlar küfr və inadlarında sabitqədəm olub şirkin zülməti onların qəlbini bürüdüyündən Qurani-Şərifin açıq-aşkar ayələri onlara təsir etməyib imana daxil olmazlar. (ey Məhəmməd), əbəs yerə sən özünə zəhmət verib onların iman etməmələrini özünə dərd etmə)**.**

**103)** (وَمَٓا اَكْثَرُ النَّاسِ وَلَوْ حَرَصْتَ بِمُؤْمِن۪ينَ) – (ey Məhəmməd)**, hər nə qədər sən onların imana daxil olmalarını istəsən də, insanların əksəriyyəti** (küfr və inadlarında qalıb) **imana gələn deyillər.**

**104)** (وَمَا تَسْـَٔلُهُمْ عَلَيْهِ مِنْ اَجْرٍ) – (ey Məhəmməd, sən Allah-Təalanın hökmünü (Qurani-Şərifi xalqa demək üçün) **onlardan bir əcr və mükafat istəmirsən,** (bəs niyə səndən qaçıb uzaqlaşırlar? Bəli, Allah-Təalanın sözlərinə qarşılıq əcr və mükafat istəmək insanların uzaqlaşmasına və müsəlmanlar arasında təfriqəyə baisdir. İlahi, sən özün dərdlərə dərman et. (Ey şəfa verən Şafi və ey hər şeyə yetən Kafi)**.** (اِنْ هُوَ اِلَّا ذِكْرٌ لِلْعَالَم۪ينَ) **- bu** (Quran) **ancaq cəmi aləmlərdən ötrü öyüd-nəsihətdir.** (Quranda elə bir söz yoxdur ki, ondan diksinib qaçsınlar)**.**

وَكَاَيِّنْ مِنْ اٰيَةٍ فِي السَّمٰوَاتِ وَالْاَرْضِ يَمُرُّونَ عَلَيْهَا وَهُمْ عَنْهَا مُعْرِضُونَ ﴿١٠٥﴾ وَمَا يُؤْمِنُ اَكْثَرُهُمْ بِاللّٰهِ اِلَّا وَهُمْ مُشْرِكُونَ ﴿١٠٦﴾ اَفَاَمِنُوٓا اَنْ تَأْتِيَهُمْ غَاشِيَةٌ مِنْ عَذَابِ اللّٰهِ اَوْ تَأْتِيَهُمُ السَّاعَةُ بَغْتَةً وَهُمْ لَا يَشْعُرُونَ ﴿١٠٧﴾ قُلْ هٰذِهٖ سَبِيلٖٓي اَدْعُوٓا اِلَى اللّٰهِ عَلٰى بَصِيرَةٍ اَنَا وَمَنِ اتَّبَعَنٖيۜ وَسُبْحَانَ اللّٰهِ وَمَٓا اَنَا مِنَ الْمُشْرِكٖينَ ﴿١٠٨﴾

---

**105) (**وَكَاَيِّنْ مِنْ اٰيَةٍ فِي السَّمٰوَاتِ وَالْاَرْضِ**) - səmalarda və yerdə necə çox əlamətlər var ki,** (Allah-Təalanın tövhid və qüdrətinə işarə edər)**.** (يَمُرُّونَ عَلَيْهَا وَهُمْ عَنْهَا مُعْرِضُونَ) – (o əlamətlərdən) **yan keçib** (onlara ibrət nəzəriylə baxmayıb) **üz döndərirlər.** (Ey Məhəmməd, o əlamətlərdən üz döndərəndən sonra səndən də üz döndərmələri təəccüblü deyil)**.**

**106) (**وَمَا يُؤْمِنُ اَكْثَرُهُمْ بِاللّٰهِ اِلَّا وَهُمْ مُشْرِكُونَ**) - insanların çoxu Allah-Təalaya ancaq şirk qoşaraq iman edərlər.***

*(*****Qeyd:** Bu ayənin təsdiqi bizim zamanımızda görülür. Müsəlmanlar adlarını mömin qoyub özlərini Quran əhli sayırlar, amma özlərindən ötrü hər bir məqamda daşdan, kəsəkdən və ağacdan ziyarətgahlar düzəldib, özlərinə məbudlar seçib, onlardan ötrü heyvanlar kəsirlər ki, onlara yaxınlaşıb, ehtiyacları həll olsun. Halbuki Qurani-Şərifin hökmüylə heyvan Allah-Təaladan başqasının adıyla kəsilsə, o heyvanın əti haramdır. Bizim zamanımızda olan müsəlmanların əməlləri eyni bütpərəstlik əməlləridir. Ehtiyacım həll olsun deyə, filan yerə, ya filan daşa və ya filan qədəmgaha, ya filan imamzadəyə qurban nəzir etmək, ehtiyacları həll olandan sonra da bunun səbəbkarı olaraq Allah-Təalanı yox, daş-kəsək, ya da imamzadələri səbəb saymaq, onlar üçün heyvan kəsmək bu ayənin tənqid hədəfidir, bu varlıq aləmində Allah-Təaladan başqa, kim və nə olursa olsun, ehtiyacını onlardan istəmək şirk əlamətidir və o şəxs müşrikdir).*

*(Yəni Allah-Təalaya iman gətirdiklərini və yaradıcının O olduğunu iqrar edirlər, amma Allah-Təaladan başqa şəxslərə yönəlib, onlardan yardım və şəfaət istəyirlər. Belə halda, özlərini mömin saysalar da, müşrikdirlər).*

**107) (**اَفَاَمِنُوٓا اَنْ تَأْتِيَهُمْ غَاشِيَةٌ مِنْ عَذَابِ اللّٰهِ**) – bəs** (müşriklər) **Allah-Təalanın əzabından bir bəlanın gəlib** (onları yaxalamasından) **amandadırlarmı?** (اَوْ تَأْتِيَهُمُ السَّاعَةُ بَغْتَةً وَهُمْ لَا يَشْعُرُونَ) **- ya da qiyamət gününün qəfildən, bixəbər olduqları halda, onlara gəlib Allah-Təalanın əzabının onları yaxalamasından amandadırlarmı?**

**108) (**قُلْ هٰذِهٖ سَبِيلٖٓي**) -** (ey Məhəmməd, müşriklərə) **de ki, bu** (tövhid və imana dəvət etmək) **mənim yolumdur,** (bundan başqa mənim yolum yoxdur)**.** (اَدْعُوٓا اِلَى اللّٰهِ عَلٰى بَصِيرَةٍ اَنَا وَمَنِ اتَّبَعَنٖي) **- mən özüm və mənə tabe olanlar açıq-aşkar dəlil, sübutla sizi Allah-Təala tərəfinə dəvət edirik.** (وَسُبْحَانَ اللّٰهِ وَمَٓا اَنَا مِنَ الْمُشْرِكٖينَ) **- Allah-Təala şirk və nöqsandan pak və müqəddəsdir. Mən də müşriklərdən deyiləm.**

وَمَآ اَرْسَلْنَا مِنْ قَبْلِكَ اِلَّا رِجَالًا نُوحٖٓي اِلَيْهِمْ مِنْ اَهْلِ الْقُرٰىۜ اَفَلَمْ يَسٖيرُوا فِي الْاَرْضِ فَيَنْظُرُوا كَيْفَ
كَانَ عَاقِبَةُ الَّذٖينَ مِنْ قَبْلِهِمْۜ وَلَدَارُ الْاٰخِرَةِ خَيْرٌ لِلَّذٖينَ اتَّقَوْاۜ اَفَلَا تَعْقِلُونَ ﴿١٠٩﴾ حَتّٰٓى اِذَا اسْتَيْـَٔسَ
الرُّسُلُ وَظَنُّٓوا اَنَّهُمْ قَدْ كُذِبُوا جَٓاءَهُمْ نَصْرُنَاۙ فَنُجِّيَ مَنْ نَشَٓاءُۜ وَلَا يُرَدُّ بَأْسُنَا عَنِ الْقَوْمِ الْمُجْرِمٖينَ
﴿١١٠﴾ لَقَدْ كَانَ فٖي قَصَصِهِمْ عِبْرَةٌ لِاُو۬لِي الْاَلْبَابِۜ مَا كَانَ حَدٖيثًا يُفْتَرٰى وَلٰكِنْ تَصْدٖيقَ الَّذٖي بَيْنَ
يَدَيْهِ وَتَفْصٖيلَ كُلِّ شَيْءٍ وَهُدًى وَرَحْمَةً لِقَوْمٍ يُؤْمِنُونَ ﴿١١١﴾

---

**109)** (وَمَآ اَرْسَلْنَا مِنْ قَبْلِكَ اِلَّا رِجَالًا نُوحٖٓي اِلَيْهِمْ مِنْ اَهْلِ الْقُرٰى) – (ey Məhəmməd, bu müşriklər sənə deyirlər: “ey Məhəmməd, əgər Allah-Təala peyğəmbər göndərmək istəsə, gərək mələk göndərsin.” Onların dediyi kimi deyil. Ey Məhəmməd)**, səndən qabaq da o məmləkətlərin əhlindən vəhy etdiyimiz neçə kişi peyğəmbərlər göndərmişdik,** (اَفَلَمْ يَسٖيرُوا فِي الْاَرْضِ فَيَنْظُرُوا كَيْفَ كَانَ عَاقِبَةُ الَّذٖينَ مِنْ قَبْلِهِمْ) **– bəs bu kafir və müşriklər yer üzündə seyr edib onlardan qabaq keçən ümmətlərin aqibətlərinin necə olduğuna baxıb** (fikir vermirlər?) (وَلَدَارُ الْاٰخِرَةِ خَيْرٌ لِلَّذٖينَ اتَّقَوْاۜ اَفَلَا تَعْقِلُونَ) – **müttəqi olub** (şirki tərk edənlərdən) **ötrü əlbəttə axirət evi yaxşıdır. Şirki tərk edib tövhidə etiqad etmək üçün düşünməzsinizmi?**

**110)** (حَتّٰٓى اِذَا اسْتَيْـَٔسَ الرُّسُلُ) – (ey Məhəmməd, səndən qabaq göndərilən) **peyğəmbərlər** (dəvət etdikləri qövmlərinin imanlarından) **ümidlərini kəsdikdə,** (وَظَنُّٓوا اَنَّهُمْ قَدْ كُذِبُوا) – **və biləndə ki,** (qövmləri) **onları təkzib edib** (sözlərini qəbul etməyəcəkdir)**,** (جَٓاءَهُمْ نَصْرُنَا) – (o vaxt) **bizim köməyimiz onlara gəlib** (qövmlərinə əzab göndərdik)**.** (فَنُجِّيَ مَنْ نَشَٓاءُ) – (peyğəmbərlərin qövmlərinə əzab nazil olan zaman) **istədiyimiz şəxsə** (möminlərə əzabdan) **nicat verdik.** (وَلَا يُرَدُّ بَأْسُنَا عَنِ الْقَوْمِ الْمُجْرِمٖينَ) – (bizim əzabımız) **günahkar** (və müşrik) **şəxslərdən geri çevrilməyib,** (o əzaba düçar olacaqlar)**.**

**111)** (لَقَدْ كَانَ فٖي قَصَصِهِمْ عِبْرَةٌ لِاُو۬لِي الْاَلْبَابِ) **- həqiqətən,** (peyğəmbərlərin) **qissələrində ağıl sahiblərindən ötrü** (öyüd və) **ibrət vardır.** (مَا كَانَ حَدٖيثًا يُفْتَرٰى) – (bu Quran) **uydurulan söz deyildir.** (وَلٰكِنْ تَصْدٖيقَ الَّذٖي بَيْنَ يَدَيْهِ) **- bəlkə** (bu Quran) **özündən əvvəlki** (kitabları) **təsdiq edəndir.** (وَتَفْصٖيلَ كُلِّ شَيْءٍ) – (din və dünyada lazım olan əmrlərin)**, şeylərin hamısının təfsilatı** (Quranda) **var,** (وَهُدًى وَرَحْمَةً لِقَوْمٍ يُؤْمِنُونَ) – (bu Quran onu təsdiq edib hökmlərinə əməl edən)**, iman edənlərdən ötrü hidayət və rəhmətdir.**

Allaha həmd olsun, Yusif surəsinin təfsiri bitdi, ibrət alanlar üçün nə gözəl qissə və tarix elminin şərəfi üçün nə böyük dəlildir, müsəlmanların əksər üləmaları tarix elmindən bixəbər olub, belə böyük bir elmi yaddan çıxarıblar, tarix elmi din və məzhəbə, mədəniyyət və siyasətə, ədalət və insafa, rəhmət və mərhəmətə, rəhbərlik və idarəçiliyə yol göstərən elmdir. Allah-Təalanın peyğəmbərlərin qissələrini Qurani-Şərifdə qeyd etməsinin məqsədi onların

ehtiva etdiyi məna və rəmzlərdən müsəlmanların agah olması və din və dünya işlərində onlardan istifadə etmələridir. Heyif, islam ümməti bu mətləblərdən bixəbər qalıb Yusif və Züleyxa qissəsini ancaq onların hüsnündən, camalından bəhs etməyə məxsus ediblər. Təfəkkür etmək lazımdır və bu səbəbdən Hz. Peyğəmbər buyurubdur: *"Hansı müsəlman Yusif surəsini oxuyub övladına və ailəsinə öyrətsə, Allah-Təala da ölümü ona asanlaşdırar və ona elə bir güc bəxş edər ki, dünyada heç kimə həsəd etməz."*




## ər-RƏD SURƏSİ

13-cü surədir. Məkkədə nazil olub, 43 ayə, 855 kəlmə, 3506 hərfdir.

بِسْمِ اللّٰهِ الرَّحْمٰنِ الرَّح۪يمِ. الٓمٓرٰ۠ تِلْكَ اٰيَاتُ الْكِتَابِۜ وَالَّذ۪ٓي اُنْزِلَ اِلَيْكَ مِنْ رَبِّكَ الْحَقُّ وَلٰكِنَّ اَكْثَرَ النَّاسِ لَا يُؤْمِنُونَ ﴿١﴾ اَللّٰهُ الَّذ۪ي رَفَعَ السَّمٰوَاتِ بِغَيْرِ عَمَدٍ تَرَوْنَهَا ثُمَّ اسْتَوٰى عَلَى الْعَرْشِ وَسَخَّرَ الشَّمْسَ وَالْقَمَرَۜ كُلٌّ يَجْر۪ي لِاَجَلٍ مُسَمًّىۜ يُدَبِّرُ الْاَمْرَ يُفَصِّلُ الْاٰيَاتِ لَعَلَّكُمْ بِلِقَٓاءِ رَبِّكُمْ تُوقِنُونَ ﴿٢﴾ وَهُوَ الَّذ۪ي مَدَّ الْاَرْضَ

---

### Bismillahir-Rəhmanir-Rəhim

**1)** (الٓمٓرٰ) **- Bu surə Əlif Ləm Mim Ra surəsidir,** (تِلْكَ اٰيَاتُ الْكِتَابِ) **- bu** (surədə qeyd olunan) **ayələr** (mükəmməl və heyrətamiz olan) **kitabın** (Quranın) **ayələridir,** (heç bir kəlam onlara qarşı dura bilməz). (وَالَّذ۪ي اُنْزِلَ اِلَيْكَ مِنْ رَبِّكَ الْحَقُّ) - (ey Məhəmməd, bu Quran) **sənə rəbbin Allah-Təaladan nazil olub haqq** (və doğru olan kitabdır). (وَلٰكِنَّ اَكْثَرَ النَّاسِ لَا يُؤْمِنُونَ) **- lakin insanların çoxu** (belə haqq olan kitaba) **iman gətirmirlər.**

**2)** (اَللّٰهُ الَّذ۪ي رَفَعَ السَّمٰوَاتِ بِغَيْرِ عَمَدٍ تَرَوْنَهَا) – **gördüyünüz kimi, Allah-Təala öz kamil qüdrəti ilə səmaları sütunsuz ucaldıb** (və bərqərar edibdir), (ثُمَّ اسْتَوٰى عَلَى الْعَرْشِ) **- səmaları ucaldandan sonra ərşə** (hakimiyyətə) **sahib olub,** (bütün məxluqat da ona tabe oldu). (وَسَخَّرَ الشَّمْسَ وَالْقَمَرَ) – (Allah-Təala öz kamil qüdrəti ilə) **günəşi və ayı özünə tabe edib,** (Onun hakimiyyətindən çıxa bilməzlər). (كُلٌّ يَجْر۪ي لِاَجَلٍ مُسَمًّى) – (günəş və ayın) **hər biri** (hərəkət edib) **müəyyən bir vaxtadək* dövr edərlər.** (يُدَبِّرُ الْاَمْرَ) **– bütün işləri O idarə edər.** (يُفَصِّلُ الْاٰيَاتِ) – (vəhdətinə işarə edən) **ayə və əlamətləri sizdən ötrü təfsilatı ilə izah edər.** (لَعَلَّكُمْ بِلِقَٓاءِ رَبِّكُمْ تُوقِنُونَ) **- əlbəttə,** (qiyamət günündə) **gərək o dəlillər səbəbinə rəbbiniz Allah-Təalanın rəhmət və əzabı ilə qarşılaşacağınızı yəqin edəsiniz.**

*(*Qeyd: O müəyyən vaxt - dünyanın fani olub Günəş, Ay və digər planetlərin məhv olma anıdır. Şəriət dilində buna qiyamət deyilir. Avropa alimlərinin qalaktikadakı planetlərin hər birinin müəyyən bir ömrü olduğunu və ondan sonra dağılıb məhv olacaqlarını demələri Qurani-Şərifdə xəbər verilən qiyamətin mütləq vaqe olacağına açıq-aşkar dəlildir).*

**3)** (وَهُوَ الَّذ۪ي مَدَّ الْاَرْضَ) - (Allah-Təala qabaqkı ayədə özünün vəhdətinə işarə edən səmadakı dəlilləri bəyan etdi. Bu ayədə yer və yerdə olan dəlilləri bəyan

وَجَعَلَ فِيهَا رَوَاسِيَ وَاَنْهَارًاۜ وَمِنْ كُلِّ الثَّمَرَاتِ جَعَلَ فِيهَا زَوْجَيْنِ اثْنَيْنِ يُغْشِي الَّيْلَ النَّهَارَۜ اِنَّ فِي ذٰلِكَ لَاٰيَاتٍ لِقَوْمٍ يَتَفَكَّرُونَ ﴿٣﴾ وَفِي الْاَرْضِ قِطَعٌ مُتَجَاوِرَاتٌ وَجَنَّاتٌ مِنْ اَعْنَابٍ وَزَرْعٌ وَنَخِيلٌ صِنْوَانٌ وَغَيْرُ صِنْوَانٍ يُسْقٰى بِمَٓاءٍ وَاحِدٍۙ وَنُفَضِّلُ بَعْضَهَا عَلٰى بَعْضٍ فِي الْاُكُلِۜ

---

edib buyurur: "Orada rahat olasınız deyə öz mükəmməl qüdrəti ilə sizdən ötrü) **yeri** (döşək kimi) **döşəyən rəbbiniz Allah-Təaladır.** (وَجَعَلَ فِيهَا رَوَاسِيَ وَاَنْهَارًا) **- o yerdə sabit və uca dağlar və o dağlardan axan çaylar yaradıbdır.** (Bütün çaylar öz başlanğıcını dağlardan alır). (وَمِنْ كُلِّ الثَّمَرَاتِ جَعَلَ فِيهَا زَوْجَيْنِ اثْنَيْنِ) - (bu ayənin mənasında bəzi təfsirçilər belə deyiblər: "Allah-Təala dünyanı yaradarkən sizdən ötrü yer üzündə hər meyvəni cüt-cüt yaratdı." Yəni hər meyvə üçün iki ağac yaratmışdı. Ondan sonra artıb çoxaldı. Bəziləri də deyiblər ki, cütlükdən məqsəd turş və şirin, ağ və qara, sarı və qırmızıdır. Belə deyiblər, lakin ayəyə belə boş məna vermək Qurani-Şərifin fəsahət və bəlağətinə ziddir. Bəlkə, Allah-Təala bu ayədə dəqiq bir hikmətə işarə buyurub və elm əhli o hikmətə indi tədricən agah olur. Botanikanın da təsdiq etdiyi kimi o hikmət budur: necə ki heyvanatın yaranmasında cütlüyə (erkək və dişi) ehtiyac var, habelə cəmi meyvələrin yaranmasında da cütlüyə ehtiyac var. Bəzi meyvələrdə cütlüklər ayrı-ayrı ağaclardadır. Necə ki xurma, çətənə ağaclarında müşahidə olunur, habelə bəzilərində də cütlük çiçəyin içində mövcuddur. Ta o cütlüyün bir-biri ilə əlaqəsi olmasa, o çiçəkdən meyvə hasil olmaz. Ayənin mənası belədir: "Allah-Təala bütün meyvələri cüt-cüt (erkək-dişi) yaratdı, (necə ki heyvanatda belədir, meyvə də cütlükdən yaranır)". (يُغْشِي الَّيْلَ النَّهَارَ) – (Allah-Təala öz kamil qüdrəti ilə) **gecənin** (qaranlığıyla) **gündüzün** (nurunu) **örtər,** (nurlu olan gündüz dönüb zülmət olar. Habelə gündüzün işıqlığıyla da gecənin qaranlığını örtər. Allah-Təaladan başqa, belə qüdrət sahibi kimdir?) (اِنَّ فِي ذٰلِكَ لَاٰيَاتٍ لِقَوْمٍ يَتَفَكَّرُونَ) **- bu qeyd olunan şeylərdə** (yaradılandan yaradanı, məxluqatdan Xaliqi dərk edib anlayan)**, düşünən qövm və camaatdan ötrü** (Allah-Təalanın tövhid və qüdrətinə) **dəlil və sübutlar vardır.**

**4)** (وَفِي الْاَرْضِ قِطَعٌ مُتَجَاوِرَاتٌ) – **yer kürəsində bir-birilərinə qonşu** (və yaxın) **olan qitələr vardır,** (bəzisi daş, bəzisi torpaq, torpağın bəzisi düzənlik, bəzisi münbit, bəzisi əkinə, digəri bağçılığa uyğundur, bunlardan başqa yerin müxtəlif qisimlərindən ləl-cəvahirat və daş-qaş çıxır, bəzi yerdən heç acı su da çıxmır. Bunlar Allah-Təalanın qüdrətinə dəlil deyilmi?) (وَجَنَّاتٌ مِنْ اَعْنَابٍ) **- yenə bəzi yerlərdə üzümdən bağlar əmələ gələr,** (bəzi yerlərdə əmələ gəlməz)**.** (وَزَرْعٌ) – (bəzi yerlərdə hər bir növ) **əkin** (buğda, arpa, noxud və onlardan başqası əmələ gələr), (وَنَخِيلٌ صِنْوَانٌ وَغَيْرُ صِنْوَانٍ) – (bəzi yerlərdə) **bir kökdən və müxtəlif köklərdən xurma ağacları** (əmələ gələr)**,** (يُسْقٰى بِمَٓاءٍ وَاحِدٍ) – (bu meyvələr və əkinlərin hamısı) **bir su ilə** (yağış və qarla) **sulanırlar.** (Yer bir, su bir, amma müxtəlif meyvələr əmələ gələr)**.** (وَنُفَضِّلُ بَعْضَهَا عَلٰى بَعْضٍ فِي الْاُكُلِ) –

اِنَّ فِي ذٰلِكَ لَاٰيَاتٍ لِقَوْمٍ يَعْقِلُونَ ﴿٤﴾ وَاِنْ تَعْجَبْ فَعَجَبٌ قَوْلُهُمْ ءَاِذَا كُنَّا تُرَابًا ءَاِنَّا لَفِي خَلْقٍ جَدِيدٍ اُولٰئِكَ الَّذِينَ كَفَرُوا بِرَبِّهِمْ وَاُولٰئِكَ الْاَغْلَالُ فِي اَعْنَاقِهِمْ وَاُولٰئِكَ اَصْحَابُ النَّارِ هُمْ فِيهَا خَالِدُونَ ﴿٥﴾ وَيَسْتَعْجِلُونَكَ بِالسَّيِّئَةِ قَبْلَ الْحَسَنَةِ وَقَدْ خَلَتْ مِنْ قَبْلِهِمُ الْمَثُلَاتُ وَاِنَّ رَبَّكَ لَذُو مَغْفِرَةٍ لِلنَّاسِ عَلٰى ظُلْمِهِمْ وَاِنَّ رَبَّكَ لَشَدِيدُ الْعِقَابِ ﴿٦﴾ وَيَقُولُ الَّذِينَ كَفَرُوا لَوْلَٓا اُنْزِلَ عَلَيْهِ اٰيَةٌ مِنْ رَبِّهِ

---

(müxtəlif olduqları üçün) **yemək baxımından onların bəzisini digərlərinə üstün tutarıq.** (Bəzisi ləziz, digərləri lap ləziz, bəziləri də dadsız olar, bəzisi şirin, bəzisi turş, bəzisi nə şirin və nə də turş (mələs) olar). (اِنَّ فِي ذٰلِكَ لَاٰيَاتٍ لِقَوْمٍ يَعْقِلُونَ) **- həqiqətən, bu** (qeyd olunan) **şeylərdə** (ağılla rəftar edən)**, düşünən bir qövm və camaatdan ötrü** (Allah-Təalanın tövhid və qüdrətinə dair) **dəlil və sübutlar vardır.**

**5)** (وَاِنْ تَعْجَبْ) **-** (ey Məhəmməd, əgər sən bu kafir və müşriklərin yenidən dirilib qiyamət gününü inkar etmələrinə) **təəccüb etsən,** (haqlısan). (فَعَجَبٌ قَوْلُهُمْ ءَاِذَا كُنَّا تُرَابًا ءَاِنَّا لَفِي خَلْقٍ جَدِيدٍ) **- həqiqətən,** (müşriklərin) **- bəs** (ölüb) **torpaq olandan sonra biz yenidən yaradılıb həyat tapacağıq?** (Bu mümkün iş deyildir)**, sözü çox təəccüblü sözdür.** (Yuxarıda qeyd olunan şeyləri ilk dəfə yaradan Allah-Təala onları yenidən yaratmaqdan aciz olarmı?) (اُولٰئِكَ الَّذِينَ كَفَرُوا بِرَبِّهِمْ) – (bu qiyaməti inkar edənlər) **o şəxslərdir ki, öz rəbləri Allah-Təalanı inkar ediblər.** (وَاُولٰئِكَ الْاَغْلَالُ فِي اَعْنَاقِهِمْ) **- və** (qiyamət günündə əzabdan ötrü) **boyunlarında zəncir olanlar da onlardır.** (وَاُولٰئِكَ اَصْحَابُ النَّارِ هُمْ فِيهَا خَالِدُونَ) **- cəhənnəm odunun yoldaşları da onlardır, əlbəttə, onlar** (cəhənnəm odunda) **həmişəlik qalacaqlar.**

**6)** (وَيَسْتَعْجِلُونَكَ بِالسَّيِّئَةِ قَبْلَ الْحَسَنَةِ) **-** (ey Məhəmməd, müşriklər) **tələsib yaxşılıqdan əvvəl pislik** (rəhmət və mərhəmətdən qabaq ilahi əzab) **istəyirlər,** (Qüreyş camaatı Hz. Peyğəmbərə istehza edib deyirdi: "Əgər sənin bu sözlərin haqdırsa, bizə səmadan əzab gəlsin", Allah-Təala bu ayədə onlara cavab verir:) (وَقَدْ خَلَتْ مِنْ قَبْلِهِمُ الْمَثُلَاتُ) – (onlar necə əzab istəyirlər?) **Halbuki onlardan qabaq** (peyğəmbərləri təkzib edənlərin əzabları)**, misalları keçib** (agah olublar. Onlardan ibrət alıb əzab istəməsinlər). (وَاِنَّ رَبَّكَ لَذُو مَغْفِرَةٍ لِلنَّاسِ عَلٰى ظُلْمِهِمْ) – (ey Məhəmməd)**, həqiqətən, sənin rəbbin Allah-Təala - insanlar özlərinə zülm edib,** (Allah-Təalaya asi olsalar da, tövbə edərlərsə)**, onları bağışlayandır.** (وَاِنَّ رَبَّكَ لَشَدِيدُ الْعِقَابِ) **- və həqiqətən, sənin rəbbin** (şirk və günah içində qalıb tövbə etməyənlərə) **şiddətli əzab edəndir.**

**7)** (وَيَقُولُ الَّذِينَ كَفَرُوا لَوْلَٓا اُنْزِلَ عَلَيْهِ اٰيَةٌ مِنْ رَبِّهِ) **-** (ey Məhəmməd)**, kafir və müşriklər deyirlər: nədən ötrü** (Məhəmmədə) **öz rəbbi Allah-Təaladan möcüzələr nazil olmur,** (ta ki biz də ona iman gətirək? Müşriklər Qurani-Şəriflə və Hz. Məhəmmədin peyğəmbərlərdən başqa heç kimdə olmayan gözəl əxlaqı və

اِنَّمَآ اَنْتَ مُنْذِرٌ وَلِكُلِّ قَوْمٍ هَادٍ ﴿٧﴾ اَللّٰهُ يَعْلَمُ مَا تَحْمِلُ كُلُّ اُنْثٰى وَمَا تَغِيضُ الْاَرْحَامُ وَمَا تَزْدَادُ وَكُلُّ
شَيْءٍ عِنْدَهُ بِمِقْدَارٍ ﴿٨﴾ عَالِمُ الْغَيْبِ وَالشَّهَادَةِ الْكَبِيرُ الْمُتَعَالِ ﴿٩﴾ سَوَآءٌ مِنْكُمْ مَنْ اَسَرَّ الْقَوْلَ
وَمَنْ جَهَرَ بِهٖ وَمَنْ هُوَ مُسْتَخْفٍ بِالَّيْلِ وَسَارِبٌ بِالنَّهَارِ ﴿١٠﴾ لَهُ مُعَقِّبَاتٌ مِنْ بَيْنِ يَدَيْهِ وَمِنْ خَلْفِهٖ

---

bəyənilən xasiyyəti ilə yetinməyib möcüzə istədilər. Daha düşünmədilər ki, möcüzə o şeydir ki, peyğəmbərin öz iddiasının müqabilində gətirib camaatın onun qarşısında aciz qaldığı şeyə möcüzə deyilir. Aralarında bir fərq yoxdur. Quran və ya başqa bir şeyin müqabilində aciz qalıb özgə şeylərdən yapışmaq inad və cəhalət əlamətidir.) (اِنَّمَآ اَنْتَ مُنْذِرٌ) – (ey Məhəmməd, bu möcüzələr ki, səndən istəyirlər, heç birisi olan deyil, həqiqətən, sən xalqı Allah-Təalanın əzabı ilə) **qorxudansan,** (amma onları imana daxil etmə qüdrəti səndə yoxdur, ancaq Allah-Təala qadirdir, əgər istəsə, onları zorla imana daxil edər)**.** (وَلِكُلِّ قَوْمٍ هَادٍ) **- hər qövmdən ötrü** (xüsusi bir möcüzə ilə) **bir hidayət etdirən** (peyğəmbər) **var.** (O möcüzə o peyğəmbərdən başqasında olmayıb, eyni möcüzə iki peyğəmbərdə olmaz. Allah-Təala məsləhət üzrə hər peyğəmbərə bir möcüzə verər. Ey Məhəmməd, səndən Musa və İsaya verilən möcüzələri istəyirlər, onlar səndən zühur etməz. Bəs bu ayəni üləma libasına bürünən nadanlar unudublar, yoxsa nəfsani arzularla bu ayəni kənara qoyub bütün peyğəmbərlərin möcüzələrini Hz. Məhəmmədə isnad edib, əgər istəsəydi, o möcüzələri gətirərdi, ya da həqiqətən, gətirib. Qurana zidd olan şeyləri etiqad kimi göstərib, ayənin xilafını, küfr və zındıqlığı camaata təbliğ edirlər?)

**8)** (اَللّٰهُ يَعْلَمُ مَا تَحْمِلُ كُلُّ اُنْثٰى) **- Allah-Təala hər bir qadının** (rəhmində olub) **daşıdığı şeydən agahdır,** (oğul, qız, gözəl, çirkin, sağlam, şikəst, nəyə hamilə olduğundan agahdır)**.** (وَمَا تَغِيضُ الْاَرْحَامُ) **- və** (qadınların) **rəhminin nəyi əskildəcəyinə,** (erkən, yoxsa şikəst doğacağından Allah-Təala agahdır)**,** (وَمَا تَزْدَادُ) **– və rəhmlərin artırdığına** (9 aydan gec və ya sağlam, yoxsa əkiz, üçər doğacağından Allah-Təala agahdır)**.** (وَكُلُّ شَيْءٍ عِنْدَهُ بِمِقْدَارٍ) **- Allah-Təalanın yanında hər bir şeyin bir həddi və ölçüsü vardır.** (Ondan artıq-əskik olmaz)**.**

**9)** (عَالِمُ الْغَيْبِ وَالشَّهَادَةِ) **– aşkara və qaibə agah olan** (Allah-Təaladır)**.** (الْكَبِيرُ الْمُتَعَالِ) **- şanı böyük,** (hər şeydən) **uca olan da** (Odur)**.**

**10)** (سَوَآءٌ مِنْكُمْ مَنْ اَسَرَّ الْقَوْلَ وَمَنْ جَهَرَ بِهٖ) **– sizdən sözünü gizlədənlə, aşkar edən Allah-Təalanın yanında eynidir.** (وَمَنْ هُوَ مُسْتَخْفٍ بِالَّيْلِ وَسَارِبٌ بِالنَّهَارِ) **- və gecənin qaranlığında** (əməllərini) **gizlədənlə, ya da gündüz camaatın arasında dolanıb** (əməllərini) **aşkar edən** (eyni olub, heç biri Allah-Təalaya məxfi qalan deyildir)**.**

**11)** (لَهُ مُعَقِّبَاتٌ مِنْ بَيْنِ يَدَيْهِ وَمِنْ خَلْفِهٖ) – (gecə-gündüz, gizlin və ya aşkar danışıb iş görən hər insandan ötrü) **onları öndən və arxadan təqib edənlər** (mələklər-

يَحْفَظُونَهُ مِنْ اَمْرِ اللّٰهِۜ اِنَّ اللّٰهَ لَا يُغَيِّرُ مَا بِقَوْمٍ حَتّٰى يُغَيِّرُوا مَا بِاَنْفُسِهِمْۜ وَاِذَٓا اَرَادَ اللّٰهُ بِقَوْمٍ سُٓوءًا فَلَا
مَرَدَّ لَهُۚ وَمَا لَهُمْ مِنْ دُونِه۪ مِنْ وَالٍ ﴿١١﴾ هُوَ الَّذ۪ي يُر۪يكُمُ الْبَرْقَ خَوْفًا وَطَمَعًا وَيُنْشِئُ السَّحَابَ
الثِّقَالَۚ ﴿١٢﴾ وَيُسَبِّحُ الرَّعْدُ بِحَمْدِه۪ وَالْمَلٰٓئِكَةُ مِنْ خ۪يفَتِه۪ۚ وَيُرْسِلُ الصَّوَاعِقَ فَيُص۪يبُ بِهَا مَنْ يَشَٓاءُ
وَهُمْ يُجَادِلُونَ فِي اللّٰهِۚ وَهُوَ شَد۪يدُ الْمِحَالِۜ ﴿١٣﴾

---

ruhani qüvvələr) **var,** (يَحْفَظُونَهُ مِنْ اَمْرِ اللّٰهِ) – **onu mühafizə edib** (məhv olmaqdan qoruyarlar. O qüvvələr Allah-Təalanın əmri ilə insanın varlığına əmanət qoyulubdur, Allah-Təala istəmədikcə insanın başından bir tük də əskik olmaz)**.** (اِنَّ اللّٰهَ لَا يُغَيِّرُ مَا بِقَوْمٍ حَتّٰى يُغَيِّرُوا مَا بِاَنْفُسِهِمْ) – **heç bir qövm özündə olan** (ixlası və ədaləti fəsad və zülmlə) **dəyişdirmədikcə, Allah-Təala ona** (verdiyi neməti və sağlamlığı) **dəyişdirməz.** (وَاِذَٓا اَرَادَ اللّٰهُ بِقَوْمٍ سُٓوءًا فَلَا مَرَدَّ لَهُ) - **Allah-Təala bir qövmü** (özlərinin zülmü səbəbilə əzab və məhv etmək) **istəsə, heç kim də** (o əzabı) **dəf edə bilməz.** (وَمَا لَهُمْ مِنْ دُونِه۪ مِنْ وَالٍ) - **Allah-Təaladan başqa onların** (işlərini idarə edən, onlardan əzabı dəf edən) **hamiləri də yoxdur.**

**12)** (هُوَ الَّذ۪ي يُر۪يكُمُ الْبَرْقَ خَوْفًا وَطَمَعًا) - **qorxu və ümiddən ötrü ildırımı sizə göstərən Allah-Təaladır.** (İldırımı görəndə onun səsindən qorxursunuz, amma çox vaxt onun sayəsində gələn yağışı arzulayırsınız)**.** (وَيُنْشِئُ السَّحَابَ الثِّقَالَ) – (yağış səbəbinə) **ağır olan buludları meydana gətirən Allah-Təaladır.**

**13)** (وَيُسَبِّحُ الرَّعْدُ بِحَمْدِه۪) – (hava buludlu olub ildırım çaxan vaxtı çıxan səs) **göy gurultusu Allah-Təalanı zikr edib həmd-səna edər,** (lakin məxluqatda o bəsirət yoxdur ki, ildırımın həmd-sənasını dərk edib anlasın), yerdəki buxarların yığılması ilə yaranan buludlardan meydana gələn göy gurultusu və ildırımın varlığı yeganə olan Allah-Təalaya həmd-səna olub, onun vücud və tövhidinə böyük olan dəlillərdəndir)**.** (وَالْمَلٰٓئِكَةُ مِنْ خ۪يفَتِه۪) - **mələklər də Allah-Təalanın heybət və əzəmətindən** (ona həmd-səna edib gözəl sifətlərlə Allah-Təalanı zikr edərlər)**.** (وَيُرْسِلُ الصَّوَاعِقَ فَيُص۪يبُ بِهَا مَنْ يَشَٓاءُ) – (Allah-Təala) **ildırımdan meydana gələn od parçalarını şiddətli səslə** (yer üzünə) **göndərib, istədiyini** (kafirləri) **vurub** (həlak edər)**.** (وَهُمْ يُجَادِلُونَ فِي اللّٰهِ) - (hansı ki Allah-Təalanın əvvəldə qeyd olunan sifətləri, zahir və batinə agah olub qüvvət və qüdrət sahibi olması haqda Hz. Peyğəmbəri təkzib edib onunla) **Allah-Təala haqqında mübahisə edirdilər.** (Ərəblərin əyanlarından Əmr ibn Tüfeyl və Ərbəd ibn Rəbiə Hz. Peyğəmbəri qətlə yetirmək qəsdiylə Mədinəyə gəldilər. Dedilər: “Ey Məhəmməd, sənin rəbbin qızıldan, gümüşdən, misdən və ya dəmirdəndir, yoxsa başqa şeydəndir?” Hz. Peyğəmbər buyurdu: “Mənim rəbbim cisim olmaqdan uzaqdır.” Hz. Peyğəmbəri qətl etməyə imkan tapmayıb, qayıdıb öz yerlərinə gedəndə Əmr ibn Tüfeylin boynuna böyük bir yara çıxıb, Ərbəd ibn Rəbiəni də ildırım vurub, hər ikisi həlak oldu)**.** (وَهُوَ شَد۪يدُ الْمِحَالِ) – (müşriklər Allah-Təala haqqında mübahisə edirlər, halbuki Allah-Təala onların məkr və

لَهُ دَعْوَةُ الْحَقِّ وَالَّذِينَ يَدْعُونَ مِنْ دُونِهِ لَا يَسْتَجِيبُونَ لَهُمْ بِشَيْءٍ اِلَّا كَبَاسِطِ كَفَّيْهِ اِلَى الْمَآءِ لِيَبْلُغَ فَاهُ وَمَا هُوَ بِبَالِغِهِ وَمَا دُعَآءُ الْكَافِرِينَ اِلَّا فِي ضَلَالٍ ﴿١٤﴾ وَلِلّٰهِ يَسْجُدُ مَنْ فِي السَّمٰوَاتِ وَالْاَرْضِ طَوْعًا وَكَرْهًا

---

hiylələrinin müqabilində məkr, hiylə edib güman etmədikləri yerdən onlara) **şiddətli əzab göndərər.**

**14)** (لَهُ دَعْوَةُ الْحَقِّ) **- haqq olan dualar Allah-Təalaya məxsusdur.** (Allah-Təala haqq olan duaları eşidib onlara cavab verib qəbul edər)**.** (وَالَّذِينَ يَدْعُونَ مِنْ دُونِهِ) **- amma** (müşriklərin) **Allah-Təaladan başqasına** (bütlərə) **etdikləri duaları** (لَا يَسْتَجِيبُونَ لَهُمْ بِشَيْءٍ اِلَّا كَبَاسِطِ كَفَّيْهِ اِلَى الْمَآءِ لِيَبْلُغَ فَاهُ وَمَا هُوَ بِبَالِغِهِ) – (sudan uzaqda və atəş içində olub)**, ağzına su gəlsin deyə** (- gəl ey su, deyərək)**, əllərini** (suya tərəf) **açıb, lakin** (idraksız olan) **suyun ona yetişməməsi kimi,** (o bütlər də o duaları) **onlardan qəbul* etməzlər.** (وَمَا دُعَاءُ الْكَافِرِينَ اِلَّا فِي ضَلَالٍ) **- kafirlərin dua edib** (bütləri çağırmaları) **zəlalətdən başqa bir şey deyil.** (Onların duası zay olub, bir fayda verən deyil)**.**

*(***Qeyd:*** Adlarını müsəlman qoyub özlərini Quran əhli sayanlar Allah-Təalanı unudub, Allah-Təaladan başqasından yardım istəməz. Bir bu ayəyə baxıb Allah-Təalanın vəhdətini düşünüb, ehtiyaclarının həllini Allah-Təalaya həvalə edib məxfi bütpərəstliyi kənara qoysunlar. Ta nə vaxta kimi Qurani-Şərifin hökmləri pərdə arxasında qalıb müsəlmanlar cəhalət libasına bürünüb, müşriklər kimi əməl edəcəklər? Hz. Peyğəmbərin zamanında olan bütpərəstlər həmin o sözləri deyirdilər ki, indi bizim bu zəmanəmizdə adlarını müsəlman qoyanlar da o sözü deyir. Çöllərdə və biyabanlarda, ya da kəndlərin, şəhərlərin ətrafında və arxların, çayların kənarında olan xarabalıqların və əşyaların ziyarətinə gedib onlara təzim edənlərə desən ki, bu əməllər bütpərəstlik əməlidir, təzim etmək və yardım istəmək ancaq bir olan Allah-Təalaya məxsusdur, hər halda o cavabı verərlər ki, hansı ki bütpərəstlər Hz. İbrahimə və Hz. Peyğəmbərə demişdilər. Onlara bütləri tərk etməyi əmr etdiklərində, dedilər: "Biz ata-babalarımızı bunlara təzim edən görmüşük, onların yolunu tərk edib sizə tabe olmaq ağılsızlıqdır." Peyğəmbərlər isə dedilər: "Siz özünüz və ata-babanız hamınız aşkar olan zəlalətdəsiniz." Müsəlmanların arasında ata-babadan qalan adətlər şəriət əmri kimi qəbul edilir. Onları o əmrdən vaz keçirmək az qala imkansızdır, ilahi, islam çırağını sönməyə qoymayıb, mədəd et!)*

*(Necə ki su cansızdır, özü insanın ağzına gəlib, susuzluğunu söndürə bilməz, insan özü suyun yanına gedib, onu içməlidirsə, habelə müşriklərin bütləri də cansız olduğundan duanı eşidib, qəbul edə bilməzlər. Müşriklərin də onlardan istədikləri yardımla ehtiyacları həll olmaz. Nə zaman bütləri tərk edib, görən və eşidən Allah-Təalaya dua edib, Ondan yardım istəsələr, ancaq o vaxt ehtiyacları həll olar).*

**15)** (وَلِلّٰهِ يَسْجُدُ مَنْ فِي السَّمٰوَاتِ وَالْاَرْضِ طَوْعًا وَكَرْهًا) – **səmalarda və yerdə olan** (məxluqat Allah-Təalanın onlardan ötrü təyin etdiyini) **istəsələr də, istəməsə-**

وَظِلَالُهُمْ بِالْغُدُوِّ وَالْاٰصَالِ ﴿١٥﴾ قُلْ مَنْ رَبُّ السَّمٰوَاتِ وَالْاَرْضِۜ قُلِ اللّٰهُۜ قُلْ اَفَاتَّخَذْتُمْ مِنْ
دُونِه۪ٓ اَوْلِيَٓاءَ لَا يَمْلِكُونَ لِاَنْفُسِهِمْ نَفْعًا وَلَا ضَرًّاۜ قُلْ هَلْ يَسْتَوِي الْاَعْمٰى وَالْبَص۪يرُۙ اَمْ هَلْ تَسْتَوِي
الظُّلُمَاتُ وَالنُّورُۚ اَمْ جَعَلُوا لِلّٰهِ شُرَكَٓاءَ خَلَقُوا كَخَلْقِه۪ فَتَشَابَهَ الْخَلْقُ عَلَيْهِمْۜ قُلِ اللّٰهُ خَالِقُ كُلِّ شَيْءٍ
وَهُوَ الْوَاحِدُ الْقَهَّارُ ﴿١٦﴾

---

**lər də** (dəf etməyə qadir deyillər, bəlkə, Allah-Təalanın iradəsini ya öz meyil və rəğbətləriylə, ya da zorla itaət edib qəbul edər) **səcdə edərlər.** (Heç kim Allah-Təalanın əmrindən qaçıb xilas ola bilməz)**.** (وَظِلَالُهُمْ بِالْغُدُوِّ وَالْاٰصَالِ) **- hətta məxluqatın kölgəsi zöhrdən qabaq** (səhər) **və əsr** (axşam) **vaxtı** (kölgə artıq və əskik olan zamanda da) **Allah-Təalaya itaət edərlər.** (Şəxsin öz kölgəsi özündən meydana gələr, öz ixtiyarı ilə olmayıb günəşin hərəkəti ilə artıq və əskik olması kölgənin Allah-Təalaya itaət etməsi deməkdir. Bəs insanın öz cismindən yaranan kölgəsini artıq və əskik olmaqdan qoruyub saxlamağa ixtiyarı vardırmı? İnsanın öz kölgəsinə ixtiyarı olmayan yerdə öz bədənindən kənar şeylərə nə ixtiyarı olacaqdır? Allahın şanı uca və böyükdür!)

**16)** (قُلْ مَنْ رَبُّ السَّمٰوَاتِ وَالْاَرْضِ) **-** (ey Məhəmməd, müşriklərə) **de ki,** (siz ki Allah-Təaladan başqa bütlərə sitayiş edirsiniz, bəs) **səmaların və yerin tərbiyə verən rəbbi kimdir?** (قُلِ اللّٰهُ) **-** (ey Məhəmməd, müşriklər inadları səbəbilə haqqı gizlətdiklərindən sən özün cavabda) **de ki, Allah-Təaladır.** (Necə ki siz də bu mətləbi inkar edən deyilsiniz, onlar da inkar etmədilər)**.** (قُلْ اَفَاتَّخَذْتُمْ مِنْ دُونِه۪ٓ اَوْلِيَٓاءَ) – (ey Məhəmməd, onlara) **de ki, indi ki belədir, səmaların və yerin tərbiyə verəni Allah-Təaladırsa), belə bir halda yenə siz Allah-Təaladan başqasını** (bütləri) **özünüzə dost** (və köməkçi) **edirsiniz?** (لَا يَمْلِكُونَ لِاَنْفُسِهِمْ نَفْعًا وَلَا ضَرًّا) **- halbuki** (o bütlər) **özlərinə xeyir və ya zərər yetirməyə qadir deyildir.** (Ağıllı şəxs belə əməl edərmi? Bu səfehlərin əməlidir)**.** (قُلْ هَلْ يَسْتَوِي الْاَعْمٰى وَالْبَص۪يرُ) **-** (ey Məhəmməd, müşriklərə) **de ki, bəs gözü kor olanla gözü görən** (işıqlı olan) **şəxs bərabər olarmı?** (Allah-Təalanı tanıyıb iman gətirən şəxslə mənəviyyatı kor, bütpərəst olan şəxs eyni olarmı? Heç vaxt bərabər olmaz)**.** (اَمْ هَلْ تَسْتَوِي الظُّلُمَاتُ وَالنُّورُ) **- ya da qaranlıqlarla işıqlıq** (şirklə iman) **bərabər olarmı?** (Əlbəttə, bərabər olmaz)**.** (اَمْ جَعَلُوا لِلّٰهِ شُرَكَٓاءَ خَلَقُوا كَخَلْقِه۪ فَتَشَابَهَ الْخَلْقُ عَلَيْهِمْ) **- yoxsa o müşriklər Allah-Təalaya onun yaratdığı kimi yaradan şəriklər qoşdular, o vaxt da onlara** (Allah-Təalanın yaratdığıyla bütlərin yaratdığı bir-birinə oxşar)**, şübhəli göründü?** (Bu səbəbdən müşriklər deyirlər: "Bizim bütlər də Allah-Təala kimi yaradıb. Niyə o bütlərə sitayiş etməyək?" İndi ki belə şey olmayıb və bütlərin heç bir şeyə qüdrəti yoxdur, cansız və aciz olan şeylərdirlər. Ağıllı şəxs də onları özünə məbud sayıb onlara sitayiş edərmi?) (قُلِ اللّٰهُ خَالِقُ كُلِّ شَيْءٍ) **-** (ey Məhəmməd)**, de ki,** (heç vaxt bütlər bir şey yaratmağa qadir deyillər)**. Hər bir şeyin xaliqi Allah-Təaladır.** (وَهُوَ الْوَاحِدُ الْقَهَّارُ) – (bü-

اَنْزَلَ مِنَ السَّمَآءِ مَآءً فَسَالَتْ اَوْدِيَةٌ بِقَدَرِهَا فَاحْتَمَلَ السَّيْلُ زَبَدًا رَابِيًاؕ وَمِمَّا يُوقِدُونَ عَلَيْهِ فِي النَّارِ
ابْتِغَآءَ حِلْيَةٍ اَوْ مَتَاعٍ زَبَدٌ مِثْلُهُؕ كَذٰلِكَ يَضْرِبُ اللّٰهُ الْحَقَّ وَالْبَاطِلَؕ فَاَمَّا الزَّبَدُ فَيَذْهَبُ جُفَآءًۚ وَاَمَّا مَا
يَنْفَعُ النَّاسَ فَيَمْكُثُ فِي الْاَرْضِؕ كَذٰلِكَ يَضْرِبُ اللّٰهُ الْاَمْثَالَؕ ﴿١٧﴾ لِلَّذِينَ اسْتَجَابُوا لِرَبِّهِمُ الْحُسْنٰىؕ
وَالَّذِينَ لَمْ يَسْتَجِيبُوا لَهُ لَوْ اَنَّ لَهُمْ مَا فِي الْاَرْضِ جَمِيعًا وَمِثْلَهُ مَعَهُ لَافْتَدَوْا بِهٖؕ

---

tün məxluqatı yaradan, onlara) **qalib və hakim olan** (şəriksiz)**, vahid Allah-Təaladır.**

**17)** (اَنْزَلَ مِنَ السَّمَآءِ مَآءً) **-** (Allah-Təala əvvəlki ayədə kafiri kora, mömini gözü görənə, küfrü zülmətə, imanı nura oxşadandan sonra bu ayədə haqq ilə batildən ötrü məsəl zikr edir: Allah-Təala sizdən ötrü) **səmadan su göndərir.** (فَسَالَتْ اَوْدِيَةٌ بِقَدَرِهَا) – (sular axıb)**, çuxur yerlərdə öz miqdarına görə cəm olur.** (فَاحْتَمَلَ السَّيْلُ زَبَدًا رَابِيًا) – (su axan vaxt sudan yaranan) **köpüyü bu sel üstündə olduğu halda götürüb aparar.** (وَمِمَّا يُوقِدُونَ عَلَيْهِ فِي النَّارِ) – (köpük bir sudan yaranır, bir də filizdən, qızıl, gümüş, mis, ya da dəmir kimi şeylərdən)**, onları əritmək üçün od verildikdə üstlərində bir növ köpük** (kəf) **olar.** (ابْتِغَآءَ حِلْيَةٍ) **- onlar zinət düzəltməkdən ötrü əridilər,** (qızıl, gümüş kimi) (اَوْ مَتَاعٍ) **- ya da başqa şeylər** (düzəltməkdən ötrü, məsələn, misdən qab, dəmirdən alət və s.) (زَبَدٌ مِثْلُهُ) - (filiz əridiləndə yaranan) **köpük** (sudan yaranan) **köpük kimidir.** (كَذٰلِكَ يَضْرِبُ اللّٰهُ الْحَقَّ وَالْبَاطِلَ) **- Allah-Təala haqq ilə batildən ötrü belə məsəl verir,** (su, qızıl, və gümüş, digər filizlər haqq, onlar əriyəndən sonra yaranan köpük isə batildən ötrü məsəldir. Batil köpük kimi zay olub qalmayandır, lakin haqq su və filiz kimi qalıb mənfəət verəndir, necə ki buyurur)**.** (فَاَمَّا الزَّبَدُ فَيَذْهَبُ جُفَآءً) **- amma kəf zay olub gedər,** (ondan heç bir xeyir gəlməz. Necə ki bütpərəstlik və islamdan kənar olmaq batil olub, bir mənfəəti olmaz)**.** (وَاَمَّا مَا يَنْفَعُ النَّاسَ فَيَمْكُثُ فِي الْاَرْضِ) **- amma insanlara mənfəət verən şey yerdə qalıb** (camaat ondan faydalanar, su və başqa filizlər kimi)**.** (كَذٰلِكَ يَضْرِبُ اللّٰهُ الْاَمْثَالَ) – **Allah-Təala** (insanlardan ötrü haqla batil barəsində) **belə məsəllər zikr edir.** (Hərçənd bəzən batil haqdan uca olub haqqa qalib olsa da (yəni bu dövrdə olduğu kimi özgə din və məzhəblər bəzən islama qalib gəlsə də), lakin haqq üzrə olanlar gərək şəkk və şübhə etməsinlər ki, aqibətdə Allah-Təala haqqı qalib edib batil zəlil olub məhv və yox olacaqdır. Necə ki su (filiz) üstündə olan köpük tez məhv olub, ondan bir iz qalmır)**.**

**18)** (لِلَّذِينَ اسْتَجَابُوا لِرَبِّهِمُ الْحُسْنٰى) – (Allah-Təalanın tövhid və imana olan dəvətini) **qəbul edib** (iman gətirənlərdən) **ötrü öz rəbləri Allah-Təala yanında gözəl və yaxşı əcrlər vardır.** (وَالَّذِينَ لَمْ يَسْتَجِيبُوا لَهُ) **- amma o şəxslər ki, Allah-Təalanın dəvətini qəbul etməyib** (imana daxil olmur)**,** (لَوْ اَنَّ لَهُمْ مَا فِي الْاَرْضِ جَمِيعًا وَمِثْلَهُ مَعَهُ لَافْتَدَوْا بِهٖ) **- əgər yerdə olan bütün xəzinələr və bir o qədəri də onların olsa, o xəzinələrin hamısını verərlər** (ki, bəlkə, Allah-Təalanın

اُولٰٓئِكَ لَهُمْ سُوٓءُ الْحِسَابِۙ وَمَأْوٰيهُمْ جَهَنَّمُۜ وَبِئْسَ الْمِهَادُ ﴿١٨﴾ اَفَمَنْ يَعْلَمُ اَنَّمَٓا اُنْزِلَ اِلَيْكَ مِنْ رَبِّكَ
الْحَقُّ كَمَنْ هُوَ اَعْمٰىۜ اِنَّمَا يَتَذَكَّرُ اُولُوا الْاَلْبَابِۙ ﴿١٩﴾ اَلَّذِينَ يُوفُونَ بِعَهْدِ اللّٰهِ وَلَا يَنْقُضُونَ الْمِيثَاقَۙ
﴿٢٠﴾ وَالَّذِينَ يَصِلُونَ مَٓا اَمَرَ اللّٰهُ بِهٖٓ اَنْ يُوصَلَ وَيَخْشَوْنَ رَبَّهُمْ وَيَخَافُونَ سُوٓءَ الْحِسَابِۜ ﴿٢١﴾ وَالَّذِينَ
صَبَرُوا ابْتِغَٓاءَ وَجْهِ رَبِّهِمْ وَاَقَامُوا الصَّلٰوةَ وَاَنْفَقُوا مِمَّا رَزَقْنَاهُمْ سِرًّا وَعَلَانِيَةً وَيَدْرَؤُنَ بِالْحَسَنَةِ
السَّيِّئَةَ اُولٰٓئِكَ لَهُمْ عُقْبَى الدَّارِۙ ﴿٢٢﴾

---

əzabından xilas olub nicat tapsınlar. Heç vaxt onlardan qəbul olunmayıb əzabdan xilas olmazlar). (اُولٰٓئِكَ لَهُمْ سُوٓءُ الْحِسَابِ) - **bunlardan ötrü qiyamət günündə diqqətli haqq-hesaba çəkilmək vardır,** (günahlarından heç bir şey bağışlanmayacaqdır). (وَمَأْوٰيهُمْ جَهَنَّمُ) - **onların məskəni cəhənnəmdir.** (وَبِئْسَ الْمِهَادُ) – (onlardan ötrü cəhənnəm) **nə pis** (döşənib, hazırlanan) **yerdir.**

**19)** (اَفَمَنْ يَعْلَمُ اَنَّمَٓا اُنْزِلَ اِلَيْكَ مِنْ رَبِّكَ الْحَقُّ) - (ey Məhəmməd)**, sənə rəbbindən nazil olan** (Quranın) **haqq olmasını bilib,** (ona iman gətirib, hər bir hökmünə əməl edən) **şəxs,** (كَمَنْ هُوَ اَعْمٰى) **- batin gözü kor olub** (Qurana iman gətirməyib onun hökmlərinə əməl etməyən) **şəxs kimidirmi?** (Əlbəttə, deyil)**.** (اِنَّمَا يَتَذَكَّرُ اُولُوا الْاَلْبَابِ) – **yalnız ağılla** (hərəkət edib) **bəsirət sahibi olanlar** (Allah-Təalanın) **öyüd-nəsihətlərini qəbul edib,** (Qurana iman gətirərlər)**.**

**20)** (اَلَّذِينَ يُوفُونَ بِعَهْدِ اللّٰهِ وَلَا يَنْقُضُونَ الْمِيثَاقَ) **- o şəxslər ki Allah-Təalanın əhdinə vəfa edib möhkəm olan əhdi pozmayıb** (Allah-Təalaya iman gətirir)**,** (Allah-Təalanın insanın Onu tanıyıb, Ona şərik qoşmaması üçün ona ağıl verməsi Allah-Təalanın əhdi deməkdir)**.**

**21)** (وَالَّذِينَ يَصِلُونَ مَٓا اَمَرَ اللّٰهُ بِهٖٓ اَنْ يُوصَلَ) **- və o şəxslər ki Allah-Təalanın əmr etdiyini** (qövm və qohum-əqrəba barəsində, ya da müsəlmanların bir-biri haqqında yaxşılıq və ehsanı) **əmələ gətirir,** (وَيَخْشَوْنَ رَبَّهُمْ وَيَخَافُونَ سُوٓءَ الْحِسَابِ) **- öz rəbləri Allah-Təalanın əzabından və xüsusən, diqqətlə haqq-hesab edilməkdən qorxur.**

**22)** (وَالَّذِينَ صَبَرُوا ابْتِغَٓاءَ وَجْهِ رَبِّهِمْ) **- və o şəxslər ki Allah-Təalanın rizasını əldə etməkdən ötrü** (bəla və möhnətə) **səbir edib** (möhkəm durur)**,** (وَاَقَامُوا الصَّلٰوةَ وَاَنْفَقُوا مِمَّا رَزَقْنَاهُمْ سِرًّا وَعَلَانِيَةً) **- və** (hər zaman dinin sütunu olan) **namazı qılıb və onlara verdiyimiz ruzilərdən gizlin, ya da aşkar** (Allah-Təala yolunda) **sədəqə və ehsan edir,** (وَيَدْرَؤُنَ بِالْحَسَنَةِ السَّيِّئَةَ) – (etdikləri) **günahı savabla dəf edib,** (tövbə edir), (اُولٰٓئِكَ لَهُمْ عُقْبَى الدَّارِ) **- bu şəxslərdən ötrü** (dünyadan köçəndən sonra Allah-Təalanın arzu etdiyi cənnət) **dünyanın** (gözəl) **sonu vardır,** (Allah-Təalanın arzusu budur ki, bu insanlar dünyadan köçəndən sonra cənnətə daxil olsunlar, necə ki sıradakı ayədə buyurur)**.**

جَنَّاتُ عَدْنٍ يَدْخُلُونَهَا وَمَنْ صَلَحَ مِنْ اٰبَآئِهِمْ وَاَزْوَاجِهِمْ وَذُرِّيَّاتِهِمْ وَالْمَلٰٓئِكَةُ يَدْخُلُونَ عَلَيْهِمْ مِنْ كُلِّ بَابٍۚ ﴿٢٣﴾ سَلَامٌ عَلَيْكُمْ بِمَا صَبَرْتُمْ فَنِعْمَ عُقْبَى الدَّارِۜ ﴿٢٤﴾ وَالَّذِينَ يَنْقُضُونَ عَهْدَ اللّٰهِ مِنْ بَعْدِ مِيثَاقِهٖ وَيَقْطَعُونَ مَٓا اَمَرَ اللّٰهُ بِهٖٓ اَنْ يُوصَلَ وَيُفْسِدُونَ فِي الْاَرْضِۙ اُولٰٓئِكَ لَهُمُ اللَّعْنَةُ وَلَهُمْ سُٓوءُ الدَّارِ ﴿٢٥﴾ اَللّٰهُ يَبْسُطُ الرِّزْقَ لِمَنْ يَشَٓاءُ وَيَقْدِرُۜ

---

**23-24)** (جَنَّاتُ عَدْنٍ يَدْخُلُونَهَا وَمَنْ صَلَحَ مِنْ اٰبَآئِهِمْ وَاَزْوَاجِهِمْ وَذُرِّيَّاتِهِمْ) – (Allah-Təala arzu etdiyi gözəl aqibət cənnət bağlarıdır, qeyd olunan şəxslər) **o bağlara daxil olarlar və onların yaxşı əməl sahibi olan ata və anaları, arvadları, övladları da** (o cənnətlərə daxil olarlar)**.** (وَالْمَلٰٓئِكَةُ يَدْخُلُونَ عَلَيْهِمْ مِنْ كُلِّ بَابٍ) **- mələklər də** (cənnət qəsrlərinin) **hər bir qapısından** (möminlərin yanına) **daxil olarlar,** (سَلَامٌ عَلَيْكُمْ بِمَا صَبَرْتُمْ) – (mələklər onlara deyərlər: "Dünyada hər bir bəla və möhnətə) **səbir etdiyiniz üçün salam olsun sizə,** (o səbəbdən belə nemətlərə nail oldunuz)**.** (فَنِعْمَ عُقْبَى الدَّارِ) **- sizdən ötrü dünyanın aqibəti nə yaxşı oldu,** (belə dərəcəyə və məqamlara sahib oldunuz." Bundan sonra gələn ayədə əvvəldə qeyd olunan yaxşı əməl sahiblərinin ziddi bəyan edilir)**.**

**25)** (وَالَّذِينَ يَنْقُضُونَ عَهْدَ اللّٰهِ مِنْ بَعْدِ مِيثَاقِهٖ) **- və o şəxslər ki Allah-Təala onlardan möhkəm əhd alandan sonra o əhdi pozur,** (ağılla hərəkət etməyib Allah-Təalaya iman gətirmir)**,** (وَيَقْطَعُونَ مَٓا اَمَرَ اللّٰهُ بِهٖٓ اَنْ يُوصَلَ) **- Allah-Təalanın əmr etdiyi** (yaxşılıq və ehsanı, qohumlarla, insanlarla əlaqəni) **kəsib** (yerinə yetirmir)**,** (وَيُفْسِدُونَ فِي الْاَرْضِ) – (Allah-Təalanı inkar edib asi olmaqla) **yer üzündə fəsad törədir,** (اُولٰٓئِكَ لَهُمُ اللَّعْنَةُ) **- bu** (qeyd olunan) **şəxslərdən ötrü Allah-Təalanın rəhmətindən uzaq olmaq** (lənət) **vardır.** (وَلَهُمْ سُٓوءُ الدَّارِ) **– və onlardan ötrü pis bir aqibət** (cəhənnəm əzabı) **vardır.**

**26)** (اَللّٰهُ يَبْسُطُ الرِّزْقَ لِمَنْ يَشَٓاءُ وَيَقْدِرُ) **- Allah-Təala istədiyinə* ruzini bol edib,** (firavan edər və çox ruzi verər)**, istədiyinə də az** (ruzi verər)**.**

*(***Qeyd:** Allah-Təalanın birinə çox, birinə az ruzi verməsi Onun hikmətinə görədir, bu məqamda heç kim Allah-Təalaya etiraz edib deyə bilməz ki, niyə mənə az, başqasına çox ruzi veribsən? Necə ki rəsmin rəssama qarşı çıxıb etiraz etməyə gücü olmaz. Amma dünyada bəzi var- dövlət sahibləri çox heyif ki, bu qazanclarını öz ağıl və kamallarına isnad edib, Qurani-Şərifin bu ayəsini unudurlar. Bu zaman onlara demək lazımdır ki, bəs bu ağıl səndə haradandır? Əgər desə ki, Allah-Təaladandır. Cavabında deyərik ki, səbəb də, səbəbin yaratdığı da Allah-Təalanın əsəridir. Ağıl Allah-Təaladan olduğundan, onun vasitəsilə meydana gələn hər şey də Allah-Təaladandır, əgər Allah-Təalanı inkar edib, özünün ağlını və varlığını təsadüf hesab etsə, o vaxt ona deyərik ki, Allah-Təalanın hökmü sənin barəndə yetişənə kimi bu batil olan sözündə qal).*

وَفَرِحُوا بِالْحَيٰوةِ الدُّنْيَاۜ وَمَا الْحَيٰوةُ الدُّنْيَا فِي الْاٰخِرَةِ اِلَّا مَتَاعٌ ۟ ﴿٢٦﴾ وَيَقُولُ الَّذِينَ كَفَرُوا لَوْلَٓا
اُنْزِلَ عَلَيْهِ اٰيَةٌ مِنْ رَبِّهٖۜ قُلْ اِنَّ اللّٰهَ يُضِلُّ مَنْ يَشَٓاءُ وَيَهْدٖٓي اِلَيْهِ مَنْ اَنَابَ ۚ ﴿٢٧﴾ اَلَّذِينَ اٰمَنُوا وَتَطْمَئِنُّ
قُلُوبُهُمْ بِذِكْرِ اللّٰهِۜ اَلَا بِذِكْرِ اللّٰهِ تَطْمَئِنُّ الْقُلُوبُۜ ﴿٢٨﴾ اَلَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ طُوبٰى لَهُمْ
وَحُسْنُ مَاٰبٍ ﴿٢٩﴾ كَذٰلِكَ اَرْسَلْنَاكَ فٖي اُمَّةٍ قَدْ خَلَتْ مِنْ قَبْلِهَٓا اُمَمٌ لِتَتْلُوَا عَلَيْهِمُ الَّذٖٓي اَوْحَيْنَٓا
اِلَيْكَ وَهُمْ يَكْفُرُونَ بِالرَّحْمٰنِۜ

---

(وَفَرِحُوا بِالْحَيٰوةِ الدُّنْيَا) – (Allah-Təalanın dünyada onlara verdiyi bol nemət səbəbilə tüğyan edib) **dünya həyatına sevinib** (axirəti unutdular). (وَمَا الْحَيٰوةُ الدُّنْيَا) (فِي الْاٰخِرَةِ اِلَّا مَتَاعٌ) **- halbuki dünyanın həyatı** (və neməti) **axirət** (nemətlərinin) **müqabilində az** (və tez fani olan) **bir şeydir.** (Əbədi neməti unudub fani nemətə aldanıb məğrur olmaq nadanlıqdır).

**27)** (وَيَقُولُ الَّذِينَ كَفَرُوا لَوْلَٓا اُنْزِلَ عَلَيْهِ اٰيَةٌ مِنْ رَبِّهٖ) **- kafir olan şəxslər deyirlər: Niyə** (Məhəmmədə) **öz rəbbi Allah-Təaladan bir möcüzə nazil olmur?"** (Bu sözləri çox təəccüblüdür, Qurani-Şərifin ayələrini möcüzə hesab etməyib başqa möcüzə istəyirlər). (قُلْ اِنَّ اللّٰهَ يُضِلُّ مَنْ يَشَٓاءُ) - (ey Məhəmməd, onların cavabında) **de ki, Allah-Təala istədiyini** (sizin kimi inadkar şəxsləri) **zəlalətdə qoyar,** (necə ki Qurani-Şərif kimi bir möcüzə sizə fayda verməyib küfrdə qalıbsınız, heç bir möcüzə sizə fayda verməyib hidayət tapmazsınız). (وَيَهْدٖٓي اِلَيْهِ مَنْ اَنَابَ) **- amma kim tövbə edib** (Haqqa yönəlsə)**, Allah-Təala onu öz tərəfinə hidayət edər.**

**28)** (اَلَّذِينَ اٰمَنُوا وَتَطْمَئِنُّ قُلُوبُهُمْ بِذِكْرِ اللّٰهِ) – (Allah-Təalaya yönəlib) **iman edən o şəxslər ki, qəlbləri Allah-Təalanın** (rəhmət və mərhəmətini) **yad etməklə aram olur,** (اَلَا بِذِكْرِ اللّٰهِ تَطْمَئِنُّ الْقُلُوبُ) - (ey Məhəmməd)**, xəbərdar ol,** (möminlərin) **qəlbi Allah-Təalanın** (rəhmət və mərhəmətini) **yad etməklə aram olub** (rahatlıq tapar).

**29)** (اَلَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ) **- o şəxslər ki** (Qurana) **iman gətirib saleh əməl edir,** (طُوبٰى لَهُمْ وَحُسْنُ مَاٰبٍ) **- onlardan ötrü** (axirətin) **xeyri və gözəl dönüləcək bir yer vardır.** (Möminlərdən ötrü cənnət nə gözəl dönüləcək yerdir).

**30)** (كَذٰلِكَ اَرْسَلْنَاكَ) - (ey Məhəmməd, başqa peyğəmbərləri göndərdiyimiz) **kimi, səni də** (xalqı dəvət etməkdən ötrü) **göndərdik ki,** (şan və fəzilətləri olsun). (فٖي اُمَّةٍ قَدْ خَلَتْ مِنْ قَبْلِهَٓا اُمَمٌ) **- səni özlərindən əvvəl çox ümmətlərin gəlib-keçdiyi bir ümmətin içinə** (göndərdik), (o ümmətlərə də peyğəmbərlər gəlmişdi). (لِتَتْلُوَا عَلَيْهِمُ الَّذٖي اَوْحَيْنَٓا اِلَيْكَ) **- ki, onlara sənə vəhy göndərdiyimiz** (kitabı - Quranı) **oxuyasan.** (وَهُمْ يَكْفُرُونَ بِالرَّحْمٰنِ) **- halbuki** (müşriklər dünya və axirət nemətinin sahibi olan və) **rəhməti çox olan Allah-Təalanı** (və sənin kimi peyğəmbəri və Quran kimi möcüzəli bir kitabı) **inkar edirlər,** (müşriklər deyirdilər: "Ey Məhəmməd, sən bizi Rəhmana itaətə dəvət edirsən, biz bil-

قُلْ هُوَ رَبّ۪ي لَٓا اِلٰهَ اِلَّا هُوَۚ عَلَيْهِ تَوَكَّلْتُ وَاِلَيْهِ مَتَابِ ﴿٣٠﴾ وَلَوْ اَنَّ قُرْاٰنًا سُيِّرَتْ بِهِ الْجِبَالُ اَوْ قُطِّعَتْ
بِهِ الْاَرْضُ اَوْ كُلِّمَ بِهِ الْمَوْتٰىۜ بَلْ لِلّٰهِ الْاَمْرُ جَم۪يعًاۜ اَفَلَمْ يَايْـَٔسِ الَّذ۪ينَ اٰمَنُٓوا

---

mirik, Rəhman nədir?) (قُلْ هُوَ رَبّ۪ي لَٓا اِلٰهَ اِلَّا هُوَ) – (ey Məhəmməd, onlara) **de ki,** (Rəhman) **mənim tərbiyə verənim, rəbbim Allah-Təaladır. Ondan başqa haqq olan məbud yoxdur.** (عَلَيْهِ تَوَكَّلْتُ وَاِلَيْهِ مَتَابِ) – (sizə qalib olmaq üçün (Rəhman) olan Allah-Təalaya təvəkkül edib, son dönüşüm də Onadır. (Sizin etdiklərinizə səbir etdiyim üçün də mənə mükafat verər)**.**

**31)** (وَلَوْ اَنَّ قُرْاٰنًا سُيِّرَتْ بِهِ الْجِبَالُ) – (Allah-Təala bu ayəni məsəl verməkdən ötrü zikr edir. Buyurur:) **əgər Quranın** (sözlərinin möhtəşəmliyindən*) **dağlar** (yerindən) **hərəkət edib yürüsə,** (اَوْ قُطِّعَتْ بِهِ الْاَرْضُ) **- ya da** (o Quranın səbəbinə) **yer parça-parça olub** (dağılsa)**,** (اَوْ كُلِّمَ بِهِ الْمَوْتٰى) **- ya da** (o Quranın səbəbinə) **ölülərlə danışılsa,** (əgər belə bir kitab axtarılsa, hər halda bu Quran olacaqdır, bundan başqa kitab ola bilməz. Bununla belə yenə iman gətirməyib başqa möcüzə istəyirlər)**.** (بَلْ لِلّٰهِ الْاَمْرُ جَم۪يعًا) **- bəlkə bütün işlər Allah-Təalanın ixtiyarındadır,** (müşriklərin istədiyi möcüzələri göndərməyə qüdrəti var, amma Allah-Təalanın hikməti onların tərk edilməsini zəruri edir)**.** (اَفَلَمْ يَايْـَٔسِ الَّذ۪ينَ اٰمَنُٓوا) **-** (ey Məhəmməd)**, bəs möminlər bu kafir və müşriklərin imanından ümidsiz olmayıblar,** (yenə ümidləri var ki, bu müşriklər ( Məkkə əhli) imana gələcək?)

*(*Qeyd:* *Qurani-Şərifdə olan öyüd-nəsihət, gözəl əxlaqa, insaf və mürüvvətlə əmr edilmək, insanlıq xüsusiyyətlərini qazanıb, cəhaləti tərk etmək əmri əgər məsələn, dağlara, yerə və ölülərə verilsəydi, hər halda dağlar yerindən hərəkət edib, yer yarılıb, ölülər danışardılar, amma cahil insanın ölü qəlbinə Qurani-Kərimin hikmət və öyüd-nəsihəti ehtiva edən ayələri təsir etməyib qara daşdan da sərt kimi durub, həşərata tay olubdur. Hz. İsa ibn Məryəmin bir dağa tərəf qaçdığını gördülər, dedilər: "Ey Ruhullah, niyə belə qaçırsan? Sənin dalınca gələn nə bir insan və nə də bir yırtıcı heyvan yoxdur." Dedi: "Cahil, nadan şəxsdən qaçıram." Dedilər: "Sən həmin İsasan ki, sözün ölülərə təsir edir, bəs cahili cəhalətindən qaytarmağa qüdrətin yoxdur?" Dedi: "Mən hərçənd cahil, nadan şəxsin qəlbini müalicə etmək istədim, amma o, müalicəni qəbul etmədi, indi ondan qaçıram." Bəli, cahilin qəlbini müalicə etmək müşkül və çətindir, bu səbəbdən Hz. Peyğəmbər buyurubdur: "Allah cahillər arasında olan alimə mərhəmət etsin." Cəhalət müalicəsi çətin olan bir xəstəlikdir, xüsusən, bir şəxs ki, cahil ola-ola cahilliyini bilməyib, özünü alim hesab etsin, ona eşşək cahilliyi deyərlər. Necə ki şair deyir: "Kim ki bilmir və bilmədiyini də bilmir, onun cəhaləti qiyamətə qədər davam edən inadkar eşşək cəhalətidir." Bizim zəmanəmiz də Hz. Peyğəmbərin yaşadığı cahiliyyə zamanının tayıdır. Necə ki o zəmanədə Qurani-Şərifin ayələri cahillərdən ötrü öldürücü zəhər kimi olub ondan qaçıb, onun ölü qəlbləri dirildən hökmlərinə qulaq asmağı özlərinə ölüm hesab edirdilər, habelə bu zamanın üləma cildindəki cahilləri də Quranın elmini imamlara həvalə etmək bəhanəsiylə Qu-*

اَنْ لَوْ يَشَآءُ اللّٰهُ لَهَدَى النَّاسَ جَمٖيعًاۜ وَلَا يَزَالُ الَّذٖينَ كَفَرُوا تُصٖيبُهُمْ بِمَا صَنَعُوا قَارِعَةٌ اَوْ تَحُلُّ قَرٖيبًا
مِنْ دَارِهِمْ حَتّٰى يَأْتِيَ وَعْدُ اللّٰهِۜ اِنَّ اللّٰهَ لَا يُخْلِفُ الْمٖيعَادَ ﴿٣١﴾ وَلَقَدِ اسْتُهْزِئَ بِرُسُلٍ مِنْ قَبْلِكَ
فَاَمْلَيْتُ لِلَّذٖينَ كَفَرُوا ثُمَّ اَخَذْتُهُمْۗ فَكَيْفَ كَانَ عِقَابِ ﴿٣٢﴾

---

*ranın hökmlərini gizlədib, Qurana müxalif olan uydurma hədisləri şəriət ehkamının əsası kimi göstərib hər biri bir məzhəb yaradıbdır, uydurma hədislərin Qurana müxalif olduğunu söylədikdə də, belə deyirlər: "Hərçənd Quranın zahiri Hz. Peyğəmbərin əvvəlki peyğəmbərlər kimi möcüzə göstərmədiyinə işarə edir, amma hədisçilər bunun xilafına olub möcüzələrin baş verdiyini sübut edirlər. Quranın zahiri buna işarə etməsə də, hökmən gərək Hz. Peyğəmbərin o möcüzələri göstərdiyinə inanaq. Amma bu mətləbdən qafil olublar ki, fəsih kəlam ona deyilir ki, onun qəsd etdiyi məna ən asan yolla başa düşülsün. Əgər Qurani-Şərifdən daha fəsih bir kəlam olsa, Quran bizdən ötrü möcüzə və dəlil ola bilməz. Əgər Qurani-Şərifin zahirindən bir məna, batinindən başqa bir məna çıxmış olsa, onu fəsahət və bəlağətdən çıxarıb tapmacaya və müəmmaya döndərər. Qurani-Şərif ərəb dilində və ərəb adət-ənənələrinə əsaslanan terminlərlə nazil olubdur. Allahın qəsd etdiyi məna da ərəblərin o terminlərdən anladığı mənadır. Ondan başqası batildir).*

(اَنْ لَوْ يَشَآءُ اللّٰهُ لَهَدَى النَّاسَ جَمٖيعًا) – (qoy bunu bilsinlər ki,) **əgər Allah-Təala istəsə, bütün insalara** (zorla) **hidayət edib islama daxil edər.** (Amma insanı ixtiyar sahibi olaraq yaratdığından imana daxil olmaq hər kəsin öz ixtiyarına həvalə olunubdur). (وَلَا يَزَالُ الَّذٖينَ كَفَرُوا تُصٖيبُهُمْ بِمَا صَنَعُوا) **- müşriklərin** (xəbis olan) **əməlləri səbəbinə həmişə bir bəla və müsibət onların özlərinə** (və övladlarına, ya da mallarına) **yetişər.** (Məkkə əhli müşriklər şirklərində möhkəm durduqlarına görə gah qıtlığa, gah da öldürülməyə, əsir olmağa düçar olurdular). (قَارِعَةٌ اَوْ تَحُلُّ قَرٖيبًا مِنْ دَارِهِمْ) **- ya da o bəla və müsibət** (Məkkənin) **ətrafına nazil olar,** (onun şəri Məkkəyə də yetişib onları qorxuya salar. İslam ordusu Məkkənin ətrafında olan müşriklərlə savaşıb, onları zəlil edən zaman Məkkə əhli qorxuya düşüb iztirab çəkdilər). (حَتّٰى يَأْتِيَ وَعْدُ اللّٰهِ) – **ta ki Allah-Təalanın vədi gəlib** (Məkkə əhlinə hər cür bəla göndərər ki, öz peyğəmbəri (Hz. Məhəmmədi əs.,) onlara qalib edib Məkkəni fəth edib müşriklərdən pak etsin). (اِنَّ اللّٰهَ لَا يُخْلِفُ الْمٖيعَادَ) **- həqiqətən, Allah-Təala öz vədinə** (peyğəmbərinə xəbər verdiyi Məkkə fəthi müjdəsinə) **xilaf çıxmaz.**

**32)** (وَلَقَدِ اسْتُهْزِئَ بِرُسُلٍ مِنْ قَبْلِكَ) **-** (ey Məhəmməd,) **həqiqətən, səndən əvvəlki peyğəmbərlərə də** (sənin kimi) **istehza edilibdir,** (necə ki bu Məkkə əhli sənə istehza edir). (فَاَمْلَيْتُ لِلَّذٖينَ كَفَرُوا) **- kafir və müşriklərin vaxtlarını uzadıb onlara möhlət verdim.** (Güman etdilər ki, həmişə sağ-salamat olacaqlar), (ثُمَّ اَخَذْتُهُمْ) **- ondan sonra onları** (dünya və axirət əzabı ilə) **yaxaladım.** (فَكَيْفَ كَانَ عِقَابِ) – (onlara) **əzabım necə oldu,** (onlara əzab etməyə qüdrətim oldu, yoxsa

اَفَمَنْ هُوَ قَآئِمٌ عَلٰى كُلِّ نَفْسٍ بِمَا كَسَبَتْۚ وَجَعَلُوا لِلّٰهِ شُرَكَآءَۜ قُلْ سَمُّوهُمْۜ اَمْ تُنَبِّؤُنَهُ بِمَا لَا يَعْلَمُ فِي
الْاَرْضِ اَمْ بِظَاهِرٍ مِنَ الْقَوْلِۜ بَلْ زُيِّنَ لِلَّذ۪ينَ كَفَرُوا مَكْرُهُمْ وَصُدُّوا عَنِ السَّب۪يلِۜ وَمَنْ يُضْلِلِ اللّٰهُ فَمَا لَهُ
مِنْ هَادٍ ﴿٣٣﴾ لَهُمْ عَذَابٌ فِي الْحَيٰوةِ الدُّنْيَا وَلَعَذَابُ الْاٰخِرَةِ اَشَقُّۚ وَمَا لَهُمْ مِنَ اللّٰهِ مِنْ وَاقٍ ﴿٣٤﴾
مَثَلُ الْجَنَّةِ الَّت۪ي وُعِدَ الْمُتَّقُونَۜ تَجْر۪ي مِنْ تَحْتِهَا الْاَنْهَارُۜ اُكُلُهَا دَٓائِمٌ وَظِلُّهَاۜ تِلْكَ عُقْبَى الَّذ۪ينَ اتَّقَوْاۗ

---

yox? Bu Məkkə əhli də qoy bundan qorxsunlar ki, onlara da möhlət verəndən sonra qəfildən tutub əzab edəm).

**33)** (اَفَمَنْ هُوَ قَآئِمٌ عَلٰى كُلِّ نَفْسٍ بِمَا كَسَبَتْ) – (o Allah-Təala ki,) **hər kəsin qazandığını qoruyub** (ona ruzi versin, xeyir və şər əməllərinə agah olsun)**, belə Allah-Təala o bütlər kimidir** (ki, aciz olub heç bir şeyə qadir olmasın?) (وَجَعَلُوا لِلّٰهِ شُرَكَآءَ) – (bununla belə, yeganə ibadət edilməyə layiq olan) **Allah-Təalaya şəriklər qoşdular.** (قُلْ سَمُّوهُمْ) **-** (ey Məhəmməd)**, müşriklərə de ki,** (Allah-Təalaya şərik qoşduqlarınızı bəyan edib) **adlandırın,** (bəlkə, Allah-Təala onları tanımır?) (اَمْ تُنَبِّؤُنَهُ بِمَا لَا يَعْلَمُ فِي الْاَرْضِ) – (Allah-Təala hər bir şeydən agahdır. Bilmədiyi heç bir şeyi Ona xəbər verə bilməzsiniz)**, bəs Allah-Təalaya o şeyi xəbər verəcəksiniz ki, yer üzündə ona agah deyil?** (Əgər yer üzündə Allah-Təalanın şəriki olsaydı, əlbəttə, şərikini tanıyardı. Yerlərə və səmalara agah olan Allah-Təala necə olur ki, öz şərikini tanımır?) (اَمْ بِظَاهِرٍ مِنَ الْقَوْلِ) **- bəlkə, siz zahirdə o sözü** (deyib, bütlərə şərik adını qoyursunuz? Onların həqiqəti yoxdur. Allah-Təala bir şeyin varlığından agah deyilsə, onun həqiqəti yoxdur. Əvvəlki ayələrin ərəbcə baxımından fəsahətinə və şəhadət məqamındakı üslubuna insafla diqqət edib baxanlar bilirlər ki, bu, insan kəlamı deyil, bu mətləbi ərəbcə bilənlər dərk edərlər)**.** (بَلْ زُيِّنَ لِلَّذ۪ينَ كَفَرُوا مَكْرُهُمْ) **- bəlkə, müşriklərə öz nəfsləri** (islam barəsində etdikləri) **məkr və hiylələrini** (və Allah-Təalaya şərik qoşmalarını) **gözəl göstərdi.** (وَصُدُّوا عَنِ السَّب۪يلِ) – (xəbis olan nəfsləri) **onları haqq yoluna tabe olmaqdan saxladı.** (O səbəbdən Allah-Təala da hidayətini onlardan kəsib zəlalətdə qaldılar)**.** (وَمَنْ يُضْلِلِ اللّٰهُ فَمَا لَهُ مِنْ هَادٍ) **- Allah-Təala** (öz xəbis olan əməllərinə görə, kimdən öz hidayətini kəsib) **onu zəlalətdə qoysa, o şəxsdən ötrü heç bir nəfər hidayət edən tapılmaz.**

**34)** (لَهُمْ عَذَابٌ فِي الْحَيٰوةِ الدُّنْيَا) – (müşriklərdən ötrü) **bu dünyada əzab vardır.** (وَلَعَذَابُ الْاٰخِرَةِ اَشَقُّ) **- əlbəttə, axirətin əzabı** (dünya əzabından) **daha şiddətlidir.** (وَمَا لَهُمْ مِنَ اللّٰهِ مِنْ وَاقٍ) – (qiyamət günündə) **Allah-Təalanın** (əzabından) **onları qoruyub saxlayan da olmaz.**

**35)** (مَثَلُ الْجَنَّةِ الَّت۪ي وُعِدَ الْمُتَّقُونَ) **- müttəqilərə vəd edilən cənnətin xüsusiyyəti** (budur:) (تَجْر۪ي مِنْ تَحْتِهَا الْاَنْهَارُ) – (qəsrlərinin və ağaclarının) **altından çaylar axar.** (اُكُلُهَا دَٓائِمٌ وَظِلُّهَا) – (o cənnətin) **meyvələri və kölgəsi daimi olub** (dünya bağlarının meyvə və kölgəsi kimi qurtaran deyil)**.** (تِلْكَ عُقْبَى الَّذ۪ينَ اتَّقَوْا) **- bu**

وَعُقْبَى الْكَافِرِينَ النَّارُ ﴿٣٥﴾ وَالَّذِينَ اٰتَيْنَاهُمُ الْكِتَابَ يَفْرَحُونَ بِمَآ اُنْزِلَ اِلَيْكَ وَمِنَ الْاَحْزَابِ مَنْ
يُنْكِرُ بَعْضَهُ قُلْ اِنَّمَآ اُمِرْتُ اَنْ اَعْبُدَ اللّٰهَ وَلَآ اُشْرِكَ بِهِ اِلَيْهِ اَدْعُوا وَاِلَيْهِ مَاٰبِ ﴿٣٦﴾ وَكَذٰلِكَ اَنْزَلْنَاهُ
حُكْمًا عَرَبِيًّا وَلَئِنِ اتَّبَعْتَ اَهْوَآءَهُمْ بَعْدَ مَا جَآءَكَ مِنَ الْعِلْمِ مَا لَكَ مِنَ اللّٰهِ مِنْ وَلِيٍّ وَلَا وَاقٍ ﴿٣٧﴾
وَلَقَدْ اَرْسَلْنَا رُسُلًا مِنْ قَبْلِكَ وَجَعَلْنَا لَهُمْ اَزْوَاجًا وَذُرِّيَّةً

---

(xüsusiyyətlər) (cənnətdəki) **müttəqi şəxslərin aqibətidir.** (Cənnətə daxil olub həmişə orada qalacaqlar). (وَعُقْبَى الْكَافِرِينَ النَّارُ) **- amma kafir və müşriklərin aqibəti cəhənnəm odudur.** (Həmişə orada əzab içində olacaqlar).

**36)** (وَالَّذِينَ اٰتَيْنَاهُمُ الْكِتَابَ يَفْرَحُونَ بِمَآ اُنْزِلَ اِلَيْكَ) - (ey Məhəmməd), **onlardan** (kitab verdiklərimizdən) **sənə iman gətirənlər** (Mədinədə iman gətirən yəhudilər; bu surə Məkkədə nazil olub) **sənə nazil olan** (Qurana) **şad olurlar.** (Hz. Peyğəmbər Mədinəyə hicrət edəndən sonra islama ilk daxil olan yəhudilər Abdullah ibn Səlam, Kə`bül-Əxbar və onların yoldaşları oldu. Xristianlardan 40 nəfər Nəcranda, 32 nəfər Həbəşdə, 8 nəfər Yəməndə islama daxil oldu, bunları Allah-Təala Məkkədə Hz. Peyğəmbərə qabaqcadan xəbər verir). (وَمِنَ الْاَحْزَابِ مَنْ يُنْكِرُ بَعْضَهُ) – (kitab əhlinin) **bəziləri də** (sənə nazil olan Quranın) **bir qismini inkar edirlər,** (kitab əhli Quranın bəzi qissələrini və onların hökmlərinə müvafiq olan bəzi hökmləri inkar etmirdilər). (قُلْ اِنَّمَآ اُمِرْتُ اَنْ اَعْبُدَ اللّٰهَ وَلَآ اُشْرِكَ بِهِ) - (ey Məhəmməd), **müşriklərə de ki, həqiqətən, mən Allah-Təala tərəfindən buna əmr olunmuşam ki,** (bir olan) **Allah-Təalaya ibadət edib ona şərik qoşmayım.** (اِلَيْهِ اَدْعُوا) – (siz müşrikləri də bir olan) **Allah-Təalaya dəvət edirəm.** (وَاِلَيْهِ مَاٰبِ) **- və dönüş yerim də Onadır,** (necə ki siz də bu mətləbi iqrar edirsiniz, inkar etməyinizin mənası yoxdur).

**37)** (وَكَذٰلِكَ اَنْزَلْنَاهُ حُكْمًا عَرَبِيًّا) – (ey Məhəmməd), **habelə bu Quranı ərəb dilinə** (tərcümə olunmuş) **hikmət olduğu halda, sənə nazil etdik,** (heç bir hikmət Qurani-Şərifin hökmlərinə müqabil ola bilməz). (وَلَئِنِ اتَّبَعْتَ اَهْوَآءَهُمْ بَعْدَ مَا جَآءَكَ مِنَ الْعِلْمِ) – (ey Məhəmməd), **Allah-Təaladan sənə elm** (Quran) **gələndən sonra əgər müşriklərin nəfsani arzularına tabe olub** (onların istəklərini yerinə yetirsən), (مَا لَكَ مِنَ اللّٰهِ مِنْ وَلِيٍّ وَلَا وَاقٍ) **- o vaxt Allah-Təalanın** (əzabından) **nə sənə bir kömək olan, nə də səni qoruyan olmaz.** (Müşriklər Hz. Peyğəmbərdən xahiş edirdilər ki, bəzi əmrlərində onlarla müvafiq olsun, Allah-Təalanın bu ayədə Hz. Peyğəmbərə qəzəblə xitab etməsinin səbəbi (hərçənd Hz. Peyğəmbər müşriklərin xahişinə tabe olan deyildi) odur ki, müsəlman olanlar da bu xitabı eşidib dinlərində möhkəm durub heç bir şəkildə müşriklərə tabe olmasınlar).

**38-39)** (وَلَقَدْ اَرْسَلْنَا رُسُلًا مِنْ قَبْلِكَ)- (ey Məhəmməd), **həqiqətən səndən qabaq peyğəmbərlər göndərdik.** (وَجَعَلْنَا لَهُمْ اَزْوَاجًا وَذُرِّيَّةً) – **onlara arvadlar və**

وَمَا كَانَ لِرَسُولٍ اَنْ يَأْتِيَ بِاٰيَةٍ اِلَّا بِاِذْنِ اللّٰهِ لِكُلِّ اَجَلٍ كِتَابٌ ﴿٣٨﴾ يَمْحُوا اللّٰهُ مَا يَشَٓاءُ وَيُثْبِتُ
وَعِنْدَهُ اُمُّ الْكِتَابِ ﴿٣٩﴾ وَاِنْ مَا نُرِيَنَّكَ بَعْضَ الَّذِي نَعِدُهُمْ اَوْ نَتَوَفَّيَنَّكَ فَاِنَّمَا عَلَيْكَ الْبَلَاغُ وَعَلَيْنَا
الْحِسَابُ ﴿٤٠﴾ اَوَلَمْ يَرَوْا اَنَّا نَأْتِي الْاَرْضَ نَنْقُصُهَا مِنْ اَطْرَافِهَا وَاللّٰهُ يَحْكُمُ لَا مُعَقِّبَ لِحُكْمِهِ

---

**uşaqlar verdik.** (Peyğəmbərlər arasında arvad-uşağı olan bir tək sən deyilsən. Müşriklər Hz. Peyğəmbərin evli olmasını ona eyib sayırdılar, yəni sən peyğəmbərsənsə, arvad-uşaq nəyinə lazımdır? Onların cavabında Allah-Təala buyurur: bu nə təəccüblü şeydir? Hər bir peyğəmbərin arvadı, uşağı olubdur). (وَمَا كَانَ لِرَسُولٍ اَنْ يَأْتِيَ بِاٰيَةٍ اِلَّا بِاِذْنِ اللّٰهِ) - **Allah-Təalanın izni olmadan heç bir peyğəmbər möcüzə gətirməyə** (qadir deyil), (ey Məhəmməd, səndən də möcüzə istəyirlər, sən öz yanından onlara möcüzə gətirməyə qadir deyilsən, əgər Allah-Təala istəsə, sənə möcüzə verər). (لِكُلِّ اَجَلٍ كِتَابٌ) - **hər bir zəmanədən ötrü bir hökm vardır,** (o hökm o vaxt yazılıb insanlara vacib olar, hər bir hökmü dəyişdirmək Allah-Təalanın ixtiyarındadır. Hər dövrün öz şərtinə görə, bir hökm verər. Bir başqa vaxt da o hökmün əksi məsləhət olanda o hökmü "nəsx" edib - ortadan qaldırıb, onun əksini verər. (Nəsxi inkar edənlərin haqqında gələn ayəni buyurur:) (يَمْحُوا اللّٰهُ مَا يَشَٓاءُ وَيُثْبِتُ) - **Allah-Təala** (hikmət üzrə hər bir hökmü) **istəsə, onu məhv edib, yerinə** (məsləhət olan başqa bir hökm) **verər,** (bu hikmət və məsləhətə Allah-Təaladan başqa agah olan yoxdur). (وَعِنْدَهُ اُمُّ الْكِتَابِ) – (hər bir kitabın, yazının və elmin əsli, anası (lövhi-məhfuz) **Allah-Təalanın yanındadır.** (Allah-Təalanın elmi hər şeyi əhatə edib heç bir şey onun elmindən kənar olmaz).

**40)** (وَاِنْ مَا نُرِيَنَّكَ بَعْضَ الَّذِي نَعِدُهُمْ) - **(ey Məhəmməd, müşriklərə vəd etdiyimiz** (o əzabların) **bəzilərini** (səni öldürmədən əvvəl) **sənə göstərsək,** (اَوْ نَتَوَفَّيَنَّكَ) **- ya da** (o əzabları sənə göstərməmiş) **səni öldürsək,** (onların əzabını görmək, ya da görməmək sənə lazım deyil. Allah-Təala hz Peyğəmbəri intizarda qoyub şövqünü artırmaqdan ötrü müşriklərin əzabının görüb görməyəcəyini ona bildirmədi ki, gördüyündə sevinci artıq olsun. Bədir savaşında onların əzabını Hz. Peyğəmbərə göstərib onun gözlərini işıqlatdı). (فَاِنَّمَا عَلَيْكَ الْبَلَاغُ) – (ey Məhəmməd)**, həqiqətən, sənə vacib olan şey** (vəhyi) **təbliğ etmək** (və xalqa ehkamı bildirməkdir)**.** (وَعَلَيْنَا الْحِسَابُ) **- amma onların haqq-hesabları bizədir.** (Bu bizdən başqa nə sənə, nə də səndən başqasına həvalə olunmayıbdır. Ancaq biz özümüz haqq-hesab edib onlara əməllərinin cəzasını verəcəyik)**.**

**41)** (اَوَلَمْ يَرَوْا اَنَّا نَأْتِي الْاَرْضَ نَنْقُصُهَا مِنْ اَطْرَافِهَا) – (bu müşriklər peyğəmbər Mədinəyə hicrət edəndən sonra ) **baxıb görmürlər ki,** (əlbəttə görəcəklər)**, həqiqətən, biz** (öz kamil qüdrətimizlə Hz. Məhəmmədi və səhabələrini onlara hakim edib)**, ətraf yerlərini əskildib necə fəth edirik?** (Bir qədər sonra Məkkəni də fəth edərik)**.** (وَاللّٰهُ يَحْكُمُ لَا مُعَقِّبَ لِحُكْمِهِ) – (islamın qalib olmasına)

وَهُوَ سَرِيعُ الْحِسَابِ ﴿٤١﴾ وَقَدْ مَكَرَ الَّذِينَ مِنْ قَبْلِهِمْ فَلِلَّهِ الْمَكْرُ جَمِيعًا يَعْلَمُ مَا تَكْسِبُ كُلُّ
نَفْسٍ وَسَيَعْلَمُ الْكُفَّارُ لِمَنْ عُقْبَى الدَّارِ ﴿٤٢﴾ وَيَقُولُ الَّذِينَ كَفَرُوا لَسْتَ مُرْسَلًا قُلْ كَفَى بِاللَّهِ
شَهِيدًا بَيْنِي وَبَيْنَكُمْ وَمَنْ عِنْدَهُ عِلْمُ الْكِتَابِ ﴿٤٣﴾

---

**Allah-Təala hökm edib, Onun hökmünü qaytaran olmaz.** (وَهُوَ سَرِيعُ الْحِسَابِ) – (dünya əzabından sonra tezliklə axirətdə) **Allah-Təala** (sizdən) **haqq-hesab çəkib** (cəza verəndir)**.**

**42)** (وَقَدْ مَكَرَ الَّذِينَ مِنْ قَبْلِهِمْ) – (ey Məhəmməd)**, həqiqətən, bu** (müşriklərdən) **əvvəlki ümmətlər də** (öz peyğəmbərlərinə zərər yetirmək üçün) **məkr və hiylə etdilər.** (Necə ki Məkkə əhli olan bu müşriklər sənə zərər yetirməkdə məkr, hiylə edirlər)**.** (فَلِلَّهِ الْمَكْرُ جَمِيعًا) **- onların bütün məkr, hiylələrinin** (cəzası) **Allah-Təalaya məxsusdur.** (Onların cəzasını verəcəkdir)**.** (يَعْلَمُ مَا تَكْسِبُ كُلُّ نَفْسٍ) – (Allah-Təala) **hər kəsin nə etdiyindən agahdır.** (وَسَيَعْلَمُ الْكُفَّارُ لِمَنْ عُقْبَى الدَّارِ) **– və kafirlər tezliklə axirətdə biləcəklər ki, dünyanın sonu** (cənnət) **kimdən ötrüdür.**

**43)** (وَيَقُولُ الَّذِينَ كَفَرُوا لَسْتَ مُرْسَلًا) **-** (ey Məhəmməd)**, kafirlər dedilər ki, sən** (Allah-Təala tərəfindən) **göndərilən peyğəmbər deyilsən.** (قُلْ كَفَى بِاللَّهِ شَهِيدًا بَيْنِي وَبَيْنَكُمْ) **-** (ey Məhəmməd, onlara) **de ki,** (mənim peyğəmbərliyimi inkar edirsiniz)**, Allah-Təala mənimlə sizin aranızda şahid olaraq kifayət edər.** (وَمَنْ عِنْدَهُ عِلْمُ الْكِتَابِ) **– və Allah-Təalanın yanında olan kitab** (Quran şahid olaraq yetər. Onun möcüzəli ayələri müqabilində heç kim bir kəlam gətirə bilməz)**.**

Həmd olsun Rəd surəsinin təfsiri bitdi. Ərəb dilinin fəsahət və bəlağətinə, rəmz və incəliklərinə agah olan şəxslər əgər insafla bu mübarək surəyə diqqət edib, fikir versələr, hər halda biləcəklər ki, bu insan kəlamı deyil, çünki belə dəqiq dəlillər gətirib sübut etmək insanın gücü xaricindədir. Bəyan və məntiq elmi üzrə alim olanlar bu mətləbdən agahdır. Hz. Peyğəmbər buyurubur: “Rəd surəsini kim oxuyub, mənasını təfəkkür etsə, Allah-Təala ona 10 savab bəxş edər və qiyamət günündə Allah-Təalanın əhdinə vəfa edənlərdən hesab olunar.”



# İBRAHİM SURƏSİ



14-cü surədir. Məkkədə nazil olub, 52 ayə, 861 kəlmə, 3434 hərfdir.

بِسْمِ اللّٰهِ الرَّحْمٰنِ الرَّحِيمِ. الٓرٰ كِتَابٌ اَنْزَلْنَاهُ اِلَيْكَ لِتُخْرِجَ النَّاسَ مِنَ الظُّلُمَاتِ اِلَى النُّورِ بِاِذْنِ رَبِّهِمْ
اِلٰى صِرَاطِ الْعَزِيزِ الْحَمِيدِۙ ﴿١﴾ اَللّٰهِ الَّذِي لَهُ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِۜ وَوَيْلٌ لِلْكَافِرِينَ مِنْ
عَذَابٍ شَدِيدٍۙ ﴿٢﴾ اَلَّذِينَ يَسْتَحِبُّونَ الْحَيٰوةَ الدُّنْيَا عَلَى الْاٰخِرَةِ وَيَصُدُّونَ عَنْ سَبِيلِ اللّٰهِ وَيَبْغُونَهَا
عِوَجًاۜ اُولٰٓئِكَ فِي ضَلَالٍ بَعِيدٍ ﴿٣﴾ وَمَٓا اَرْسَلْنَا مِنْ رَسُولٍ اِلَّا بِلِسَانِ قَوْمِهِ

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1)** (الٓرٰ) **surəsidir.** (كِتَابٌ اَنْزَلْنَاهُ اِلَيْكَ) - (ey Məhəmməd)**, bu** (Quran kamil) **bir kitabdır. Nazil etmişik sənə,** (لِتُخْرِجَ النَّاسَ مِنَ الظُّلُمَاتِ اِلَى النُّورِ بِاِذْنِ رَبِّهِمْ اِلٰى صِرَاطِ الْعَزِيزِ الْحَمِيدِ) **- ta ki xalqı küfr qaranlıqlarından çıxarıb, öz rəblərinin izin və yardımı ilə məxluqata qalib olub, hər bir həmd-sənaya layiq olan Allah-Təalanın işıqlı və aşkar olan yoluna qovuşdurasan.**

**2)** (اَللّٰهِ الَّذِي لَهُ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِ) **- məxluqata qalib olan elə Allah-Təaladır ki, səmalarda və yerdə olan hər bir şey ona məxsusdur.** (وَوَيْلٌ لِلْكَافِرِينَ مِنْ عَذَابٍ شَدِيدٍ) **– vay** (axirət gününün) **şiddətli əzabına düçar olub** (ah-nalə edən) **kafirlərin** (halına)**,** (yəni kafirlər axirətin şiddətli əzabını görəndə fəryad edib - vaveyla deyərlər)**.**

**3)** (اَلَّذِينَ يَسْتَحِبُّونَ الْحَيٰوةَ الدُّنْيَا عَلَى الْاٰخِرَةِ) **- o şəxslər ki, dünya həyatını əbədi axirətdən üstün tutur,** (وَيَصُدُّونَ عَنْ سَبِيلِ اللّٰهِ) – (xalqın) **Allah-Təalanın dininə** (islama) **daxil olmasına mane olur,** (وَيَبْغُونَهَا عِوَجًا) – (və xalqı çəkindirmək üçün islamda eyib və) **əyrilik axtarırlar,** (اُولٰٓئِكَ فِي ضَلَالٍ بَعِيدٍ) **- belə şəxslər** (haqq yolundan) **uzaq olan zəlalətdə və asilikdədirlər.**

**4)** (وَمَٓا اَرْسَلْنَا مِنْ رَسُولٍ اِلَّا بِلِسَانِ قَوْمِهِ) - (ey Məhəmməd)**, elə bir peyğəmbər göndərmədik ki, öz qövmünün* dili üzrə olmasın.**

*(*Qeyd: sual: Allah-Təala ayədə buyurur: Elə bir peyğəmbər göndərmədik ki, öz qövmünün dili üzrə olmasın. Qurani-Şərifin bir neçə ayəsindən məlumdur ki, Hz. Məhəmməd ibn Abdullah (ə.s), cəmi yer üzündə olan insanlara peyğəmbər göndərilibdir. Amma bu ayənin məzmununa görə, Hz. Peyğəmbər ya gərək ancaq ərəblərə göndəriləydi, ya da dünyada müxtəlif dillərə sahib olan qövmlərin hər birinə bir kitab gətirəydi. O zaman bütün insanlara göndərildiyi görülərdi. Cavab: Qurani-Şərifin bu*

لِيُبَيِّنَ لَهُمْ فَيُضِلُّ اللّٰهُ مَنْ يَشَٓاءُ وَيَهْد۪ي مَنْ يَشَٓاءُ وَهُوَ الْعَز۪يزُ الْحَك۪يمُ ﴿٤﴾ وَلَقَدْ اَرْسَلْنَا مُوسٰى بِاٰيَاتِنَٓا
اَنْ اَخْرِجْ قَوْمَكَ مِنَ الظُّلُمَاتِ اِلَى النُّورِ وَذَكِّرْهُمْ بِاَيَّامِ اللّٰهِ اِنَّ ف۪ي ذٰلِكَ لَاٰيَاتٍ لِكُلِّ صَبَّارٍ شَكُورٍ ﴿٥﴾

---

*hökmünə, yəni Hz. Məhəmməd ibn Abdullahın (ə.s), yer üzündə olan bütün insanlara göndərildiyinə şübhə yoxdur. Amma hər bir qövmə öz dilində kitab gətirmək lazım deyil. O zaman gərək peyğəmbər bir yerdə, ya da bir ölkədə çox durmayıb, bütün dünyanı gəzib vəhyi təbliğ etsin. Bəs buna ömür çatarmı? Hər qövmün arasında ən azından 5 il qalıb, onların öz dilindəki kitabı təbliğ etsə, 4, ya da 5 qövmdən artığına təbliğ etməyə qadir olmayıb, ömrü də vəfa etməz. Ya da yer üzündə olan bütün bölgələri gəzib hər birində 3 gün, 5 gün qalsa, bu şəkildə də vəhyin təbliği mümkün olmaz. Və ya müxtəlif dillərdə olan kitablar gərək hamısı bir dəfə də peyğəmbərə nazil olub, o da onları dəvə karvanlarına yükləyib bütün dünyanı gəzəydi ki, buna da 100 Nuh ömrü lazımdır. Bu da imkansız olub, hər bölgənin öz qonşusu tərəfindən anlaşılmayan bir dili və hər dilin öz imkanları var ki, bəzən o dildə kitab yazıb, mətləbi başa salmaq mümkün olmaz. Peyğəmbərin fəziləti onun kitabıyla məlum olur. O dil ki fəsahət və bəlağətdə üstün olub, onun hər bir sözündə müxtəlif incəliklər olsun və hər bir müxtəsər kəlamı müxtəlif mənaları ehtiva etsin, o dildə olan kitab fəzilətli kitab olub, o kitabın sahibi olan peyğəmbərin fəziləti də o kitabdan zahir olar, amma bəzi dillər var ki, fərqli dillərdən və az saydakı kəlmələrdən ibarət olub, ədəbi xüsusiyyəti də yoxdur. Onunla ancaq bəzi xırda qövmlər, səhra və kənd əhli danışar. O dildə peyğəmbər və kitab göndərmək ağıl və hikmətə ziddir. Hər bir şəriət sahibi peyğəmbərə bir kitab lazımdır. Hamısından asanı o peyğəmbərin öz dilində kitab gətirməsidir. O dilə agah olanlar da o kitabı anlamayanlara tərcümə və izah edib bəyan edərlər. Kitab yazmanın məqsədi də budur. Bu səbəbdən fəsahət və bəlağətdə insan gücünün fövqündə olan Qurani-Şərif Allah-Təala tərəfindən yer üzündə olan bütün qövmlərə göndərildiyindən lazımdır ki, o da müxtəlif dillərə tərcümə və təfsir olunsun ki, o dildə danışanlar da onun ehtiva etdiyi hikmət və nəsihətlərdən faydalana bilsinlər. Yardım və müvəffəqiyyət Allahdandır).*

(لِيُبَيِّنَ لَهُمْ) **- ta ki** (öz qövmündən ötrü Allah-Təala hökmlərini onların öz dili ilə) **bəyan edib anlatsın.** (فَيُضِلُّ اللّٰهُ مَنْ يَشَٓاءُ وَيَهْد۪ي مَنْ يَشَٓاءُ) **- Allah-Təala istədiyini zəlalətdə qoyar,** (Allah-Təala öz ixtiyarıyla iman etməyib, küfr içində qalandan başqasının zəlalətdə qalmasını istəməz) **və istədiyinə** (yardım edib) **hidayət edər, (imanında sabit edər, öz ixtiyarıyla imana daxil olub sabit olan şəxsin imanda qalmasını istəyər).** (وَهُوَ الْعَز۪يزُ الْحَك۪يمُ) **- Allah-Təala məxluqatına qalibdir. Heç kim ona qalib ola bilməz. Hikmət üzrə** (kafiri zəlalətdə, mömini hidayətdə sabit edər)**.**

**5)** (وَلَقَدْ اَرْسَلْنَا مُوسٰى بِاٰيَاتِنَٓا اَنْ اَخْرِجْ قَوْمَكَ مِنَ الظُّلُمَاتِ اِلَى النُّورِ) - (ey Məhəmməd)**, həqiqətən,** (Musanı) **ayə və möcüzələrimizlə göndərdik və ona dedik ki, qövmün** (bəni-İsraili) **qaranlıqlardan işıqlığa çıxart,** (وَذَكِّرْهُمْ بِاَيَّامِ اللّٰهِ) – (ey Musa)**, onlara** (bəni-İsrailə) **Allah-Təalanın günlərini** (əvvəlki ümmətlərə əzab göndərdiyi zamanı) **xatırladıb** (əzabımızla onları qorxut)**.** (اِنَّ ف۪ي ذٰلِكَ لَاٰيَاتٍ لِكُلِّ صَبَّارٍ شَكُورٍ) **- həqiqətən,** (əvvəlki ümmətlərin əhvalatında hər bir bəlalara)

وَاِذْ قَالَ مُوسٰى لِقَوْمِهِ اذْكُرُوا نِعْمَةَ اللّٰهِ عَلَيْكُمْ اِذْ اَنْجٰيكُمْ مِنْ اٰلِ فِرْعَوْنَ يَسُومُونَكُمْ سُوٓءَ الْعَذَابِ وَيُذَبِّحُونَ اَبْنَٓاءَكُمْ وَيَسْتَحْيُونَ نِسَٓاءَكُمْ ۜ وَفِي ذٰلِكُمْ بَلَٓاءٌ مِنْ رَبِّكُمْ عَظِيمٌ ۟ ﴿٦﴾ وَاِذْ تَاَذَّنَ رَبُّكُمْ لَئِنْ شَكَرْتُمْ لَاَزِيدَنَّكُمْ وَلَئِنْ كَفَرْتُمْ اِنَّ عَذَابِي لَشَدِيدٌ ﴿٧﴾ وَقَالَ مُوسٰىٓ اِنْ تَكْفُرُوٓا اَنْتُمْ وَمَنْ فِي الْاَرْضِ جَمِيعًاۙ فَاِنَّ اللّٰهَ لَغَنِيٌّ حَمِيدٌ ﴿٨﴾ اَلَمْ يَأْتِكُمْ نَبَؤُا الَّذِينَ مِنْ قَبْلِكُمْ قَوْمِ نُوحٍ وَعَادٍ وَثَمُودَ ۜ وَالَّذِينَ مِنْ بَعْدِهِمْ ۜ لَا يَعْلَمُهُمْ اِلَّا اللّٰهُ ۜ

---

**səbir edib** (nemətlərə) **şükür edən şəxslərdən ötrü** (Allah-Təalanın tövhid və qüdrətinə dair) **dəlil və sübutlar vardır.** (Allah-Təalanın buyurduğuna görə Hz. Musa keçmiş qövmlərin xəbərlərini öz qövmünə danışıb, onları haqq tərəfinə dəvət edir, necə ki sıradakı ayədə xəbər verir)**.**

**6)** (وَاِذْ قَالَ مُوسٰى لِقَوْمِهِ اذْكُرُوا نِعْمَةَ اللّٰهِ عَلَيْكُمْ) – **elə ki Musa öz qövmü** (bəni-İsrailə) **dedi:** (ey bəni-İsrail)**, Allah-Təalanın sizə verdiyi nemətlərini yadınıza salın.** (اِذْ اَنْجٰيكُمْ مِنْ اٰلِ فِرْعَوْنَ يَسُومُونَكُمْ سُوٓءَ الْعَذَابِ) – (o nemətlər budur: o zamanı yadınıza salın ki, Allah-Təala sizə bol nemət və) **firon əhlindən sizə nicat vermişdi. Hansı ki onlar sizdən ötrü pis əzablar axtarırdılar ki, sizə əzab etsinlər.** (وَيُذَبِّحُونَ اَبْنَٓاءَكُمْ وَيَسْتَحْيُونَ نِسَٓاءَكُمْ) **- oğullarınızı kəsib, qadınlarınızı diri saxlayırdılar,** (وَفِي ذٰلِكُمْ بَلَٓاءٌ مِنْ رَبِّكُمْ عَظِيمٌ) – **bu** (firon əhlinin sizə düçar olmasında) **sizin üçün rəbbiniz Allah-Təaladan böyük bəla vardır.** (yəni siz bəni-İsrailin xəbis əməllərinə görə, Allah-Təala firon və onun əhlini sizə düçar etdi)**.**

**7)** (وَاِذْ تَاَذَّنَ رَبُّكُمْ لَئِنْ شَكَرْتُمْ لَاَزِيدَنَّكُمْ) **-** (Musa deyir: ey bəni-İsrail, yadınıza salın ki,) **Allah-Təala sizə** (onda heç bir şəkk-şübhə olmayan) **belə elan etmişdi: əgər** (mənim nemətlərimə) **şükür etsəniz, sizə** (olan nemətimi) **daha da artıraram.** (وَلَئِنْ كَفَرْتُمْ اِنَّ عَذَابِي لَشَدِيدٌ) **- amma əgər** (mənim nemətlərimə) **nankor olsanız, o vaxt** (bilin ki,) **həqiqətən,** (nankorlara) **əzabım çox şiddətli olacaqdır.**

**8)** (وَقَالَ مُوسٰىٓ اِنْ تَكْفُرُوٓا اَنْتُمْ وَمَنْ فِي الْاَرْضِ جَمِيعًا) **- Musa dedi:** (ey bəni-İsrail)**, əgər siz və yer üzündə olan cəmi məxluqat** (Allah-Təalanı) **inkar etsə,** (Allah-Təalaya heç bir zərər yetirə bilməzsiniz)**.** (فَاِنَّ اللّٰهَ لَغَنِيٌّ حَمِيدٌ) **- həqiqətən, Allah-Təala** (sizə) **möhtac olmayıb, həmd-səna olunmağa layiqdır.**

**9)** (اَلَمْ يَأْتِكُمْ نَبَؤُا الَّذِينَ مِنْ قَبْلِكُمْ) – (ey bəni İsrail)**, bəs sizdən əvvəlki ümmətlərin xəbəri sizə gəlib yetişməyibdir** (ki, Allah-Təalaya asi olduqları üçün onlara necə əzab edildi?) (قَوْمِ نُوحٍ وَعَادٍ وَثَمُودَ) – (bu peyğəmbərlərin) **ümmətlərinə** (Allah-Təala əzab göndərib hamısını həlak etdi)**.** (وَالَّذِينَ مِنْ بَعْدِهِمْ لَا يَعْلَمُهُمْ اِلَّا اللّٰهُ) – (bir də) **onlardan sonra gələn ümmətlərə** (əzab göndərdi)**. Onların** (sayına və necə əzab gəldiyinə) **Allah-Təaladan* başqası agah ola bilməz.**

**جَآءَتْهُمْ رُسُلُهُمْ بِالْبَيِّنَاتِ فَرَدُّوٓا اَيْدِيَهُمْ فٖٓي اَفْوَاهِهِمْ وَقَالُوٓا اِنَّا كَفَرْنَا بِمَآ اُرْسِلْتُمْ بِهٖ وَاِنَّا لَفٖي شَكٍّ**
**مِمَّا تَدْعُونَنَآ اِلَيْهِ مُرٖيبٍ ﴿٩﴾ قَالَتْ رُسُلُهُمْ اَفِي اللّٰهِ شَكٌّ فَاطِرِ السَّمٰوَاتِ وَالْاَرْضِ يَدْعُوكُمْ لِيَغْفِرَ**
**لَكُمْ مِنْ ذُنُوبِكُمْ وَيُؤَخِّرَكُمْ اِلٰٓى اَجَلٍ مُسَمًّىۜ قَالُوٓا اِنْ اَنْتُمْ اِلَّا بَشَرٌ مِثْلُنَاۜ تُرٖيدُونَ اَنْ تَصُدُّونَا عَمَّا**
**كَانَ يَعْبُدُ اٰبَآؤُ۬نَا فَأْتُونَا بِسُلْطَانٍ مُبٖينٍ ﴿١٠﴾ قَالَتْ لَهُمْ رُسُلُهُمْ اِنْ نَحْنُ اِلَّا بَشَرٌ مِثْلُكُمْ**

---

*(*Qeyd: O şəxslər ki, soy elmini bildiyini iddia edib peyğəmbərimizin soyunu İsmayıl və İbrahimə, onlardan da Adəmə kimi sayıb və hamısını da mömin kimi qələmə verirlər, bu ayə onları yalançı sayır və sözlərini rədd edir. İbn Abbas deyir: “Adnan ilə İsmayıl arasında 30 nəfər var ki, heç biri məlum deyil. Adnan Hz. İsmayılın nəslindən olub, peyğəmbərimizin ulu babalarındandır.” İbn Abbas bu ayəni oxuyanda deyərdi: “Soy elmini iddia edənlər yalan deyir, Allah-Təala bu ayədə onların soy elmini bilmədiyini göstərir”).*

(جَآءَتْهُمْ رُسُلُهُمْ بِالْبَيِّنَاتِ) – (Allah-Təaladan başqa heç kimin bilmədiyi ümmətlərə) **peyğəmbərləri açıq-aşkar dəlil və möcüzələrlə gəldilər.** (فَرَدُّوٓا اَيْدِيَهُمْ فٖٓي اَفْوَاهِهِمْ) – (peyğəmbərlər onları dəvət etdilər)**, onlar əllərini ağızlarına qoyub,** (qəzəb və təəccüblərindən əllərini dişlədilər). (وَقَالُوٓا اِنَّا كَفَرْنَا بِمَآ اُرْسِلْتُمْ بِهٖ) – (ondan sonra cavab verib) **dedilər: “Həqiqətən, sizinlə göndərilən** (sözləri) **inkar etdik.** (وَاِنَّا لَفٖي شَكٍّ مِمَّا تَدْعُونَنَآ اِلَيْهِ مُرٖيبٍ) **- və həqiqətən, bizi dəvət etdiyiniz şeyə də** (Allah-Təalaya iman gətirməyə) **şəkk etdik,** (buna arxayın deyilik, sizin sözünüzü necə qəbul edək? Heç vaxt sizi təsdiq etmərik)**.”**

**10)** (قَالَتْ رُسُلُهُمْ اَفِي اللّٰهِ شَكٌّ فَاطِرِ السَّمٰوَاتِ وَالْاَرْضِ) – (onların cavabında) **peyğəmbərlər dedilər: “Səmaları və yeri yoxdan yaradan Allah-Təalaya şəkkiniz var?** (يَدْعُوكُمْ لِيَغْفِرَ لَكُمْ مِنْ ذُنُوبِكُمْ) **- Allah-Təala sizi öz tərəfinə dəvət edir ki, günahlarınızı bağışlasın.** (وَيُؤَخِّرَكُمْ اِلٰٓى اَجَلٍ مُسَمًّى) **- və** (əgər iman gətirsəniz, əzabınızı) **müəyyən bir vaxta kimi** (ölənə qədər) **təxirə salıb** (dünyada sizə əzab etməz)**.”** (قَالُوٓا اِنْ اَنْتُمْ اِلَّا بَشَرٌ مِثْلُنَا) – (peyğəmbərlərin cavabında) **ümmətlər dedilər: “Siz də bizim kimi insansınız,** (bizdən bir fərqiniz yoxdur, səbəb nədir ki siz peyğəmbər olmusunuz? Peyğəmbər gərək mələklərdən olsun)**.** (تُرٖيدُونَ اَنْ تَصُدُّونَا عَمَّا كَانَ يَعْبُدُ اٰبَآؤُ۬نَا) **- sizin istəyiniz odur ki, bizi ata-babamızın ibadət etdiyi şeylərdən döndərəsiniz.** (Sizin başqa bir məqsədiniz yoxdur)**.** (فَأْتُونَا بِسُلْطَانٍ مُبٖينٍ) **- bizdən ötrü** (öz iddianızın doğruluğuna) **açıq-aşkar bir dəlil gətirin,** (ki, sizin peyğəmbər olmağınız məlum olsun. Dəlilsiz, sübutsuz peyğəmbər göndərilməz. Halbuki peyğəmbərlər onlara dəlil və sübut gətirmişdi, müşriklərin arzusu öz istədikləri dəlillərdir. Peyğəmbərlərin gətirdiyi dəlillə kifayət etməyib, başqa dəlil istədilər)**.**

**11)** (قَالَتْ لَهُمْ رُسُلُهُمْ اِنْ نَحْنُ اِلَّا بَشَرٌ مِثْلُكُمْ) **- onların** (cavabında) **peyğəmbərləri dedilər: “**(siz doğru deyirsiniz)**, biz də sizin kimi insanıq.** (İnsan kimi eyniyik,

وَلٰكِنَّ اللّٰهَ يَمُنُّ عَلٰى مَنْ يَشَٓاءُ مِنْ عِبَادِهٖۜ وَمَا كَانَ لَنَٓا اَنْ نَأْتِيَكُمْ بِسُلْطَانٍ اِلَّا بِاِذْنِ اللّٰهِۜ وَعَلَى اللّٰهِ فَلْيَتَوَكَّلِ الْمُؤْمِنُونَ ﴿١١﴾ وَمَا لَنَٓا اَلَّا نَتَوَكَّلَ عَلَى اللّٰهِ وَقَدْ هَدٰينَا سُبُلَنَاۜ وَلَنَصْبِرَنَّ عَلٰى مَٓا اٰذَيْتُمُونَاۜ وَعَلَى اللّٰهِ فَلْيَتَوَكَّلِ الْمُتَوَكِّلُونَ ﴿١٢﴾ وَقَالَ الَّذٖينَ كَفَرُوا لِرُسُلِهِمْ لَنُخْرِجَنَّكُمْ مِنْ اَرْضِنَٓا اَوْ لَتَعُودُنَّ فٖي مِلَّتِنَاۜ فَاَوْحٰٓى اِلَيْهِمْ رَبُّهُمْ لَنُهْلِكَنَّ الظَّالِمٖينَ ﴿١٣﴾ وَلَنُسْكِنَنَّكُمُ الْاَرْضَ مِنْ بَعْدِهِمْۜ ذٰلِكَ لِمَنْ خَافَ مَقَامٖي وَخَافَ وَعٖيدِ ﴿١٤﴾

---

amma bütün insanlar eyni xüsusiyyətdə deyil). (وَلٰكِنَّ اللّٰهَ يَمُنُّ عَلٰى مَنْ يَشَٓاءُ مِنْ عِبَادِهٖ) - **lakin Allah-Təala qullarından kimə istəsə, ona nemət verib** (peyğəmbərlik bəxş edər). (وَمَا كَانَ لَنَٓا اَنْ نَأْتِيَكُمْ بِسُلْطَانٍ اِلَّا بِاِذْنِ اللّٰهِ) - (hökm edib bizdən dəlil və möcüzə istəyirsiniz, amma) **Allah-Təalanın izni olmadan** (bizdə elə bir ixtiyar və qüdrət yoxdur ki, öz yanımızdan) **sizə istədiyiniz möcüzəni gətirək.** (وَعَلَى اللّٰهِ فَلْيَتَوَكَّلِ الْمُؤْمِنُونَ) - **gərək möminlər** (hər bir işlərində) **Allah-Təalaya təvəkkül etsinlər.** (Bizim də vəzifəmiz budur ki, inad və əziyyətlərə səbir edib Allah-Təalaya təvəkkül edək ki, Allah-Təalanın hökmü nazil olsun)**.**

**12)** (وَمَا لَنَٓا اَلَّا نَتَوَكَّلَ عَلَى اللّٰهِ) **- bizə nə olubdur ki, Allah-Təalaya təvəkkül etməyək?** (وَقَدْ هَدٰينَا سُبُلَنَا) **- halbuki bizə hidayət edib** (din) **yolumuzu göstəribdir.** (Belə vaxtda Allah-Təalaya təvəkkül etmək bizə vacibdir). (وَلَنَصْبِرَنَّ عَلٰى مَٓا اٰذَيْتُمُونَا) **- "Əlbəttə, gərək** (dil və əməllə) **bizə etdiyiniz əziyyətlərinizə səbir edək.** (وَعَلَى اللّٰهِ فَلْيَتَوَكَّلِ الْمُتَوَكِّلُونَ) **– gərək Allah-Təalaya təvəkkül edib** (öz təvəkküllərində möhkəm olsunlar)**.**

**13-14)** (وَقَالَ الَّذٖينَ كَفَرُوا لِرُسُلِهِمْ) **- kafir olan şəxslər öz peyğəmbərlərinə dedilər:** (لَنُخْرِجَنَّكُمْ مِنْ اَرْضِنَٓا اَوْ لَتَعُودُنَّ فٖي مِلَّتِنَا) **- əlbəttə, ya sizi öz yerimizdən qovub çıxararaq, ya da qayıdıb bizim dinimizə daxil olarsınız.** (فَاَوْحٰٓى اِلَيْهِمْ رَبُّهُمْ) - (ümmətlərin sözü bu məqama çatanda) **- rəbləri Allah-Təala peyğəmbərlərə vəhy göndərib** (dedi:) (لَنُهْلِكَنَّ الظَّالِمٖينَ وَلَنُسْكِنَنَّكُمُ الْاَرْضَ مِنْ بَعْدِهِمْ) – (ey peyğəmbərlər, bunlar sizə itaət etmədilər)**, əlbəttə, bu zalım olan camaatları həlak edib onlardan sonra sizi onların yerində sakin* edəcəyik.** (ذٰلِكَ لِمَنْ خَافَ مَقَامٖي وَخَافَ وَعٖيدِ) – (zalımı həlak edib mömini ona varis etmək qiyamət günündə haqq-hesabdan ötrü) **mənim hüzurumda durmaqdan və əzabımdan qorxan şəxslərə** (aid olub)**, onlardan ötrü ibrətdir.**

*(*Qeyd: Zülm son dərəcə qəbih sifətlərdəndir. Zalımın zülmü davam etməz, az bir zaman içində özü də, ailəsi də məhv olar. Hz. Peyğəmbər buyurubdur: "Kim öz qonşusuna əziyyət etsə, Allah-Təala onun evini o qonşuya qismət edər." Zəməxşəri belə deyir: "Mən bu mətləbi bu yaxın zamanda gördüm, bizim kəndin ağası mənim dayıma son dərəcə əziyyət və zülm edirdi. Dayıma görə mənə də əziyyət edirdi. Axırda o ağa ölüb Allah-Təala onun mülkünü mənə qismət etdi. Bir gün dayımın oğullarına baxdım. Gördüm, onlar da onun evinə girib-çıxırlar. Hz. Peyğəmbərin bu hədisi yadıma düşdü,*

وَاسْتَفْتَحُوا وَخَابَ كُلُّ جَبَّارٍ عَنِيدٍۙ ﴿١٥﴾ مِنْ وَرَآئِهٖ جَهَنَّمُ وَيُسْقٰى مِنْ مَآءٍ صَدِيدٍۙ ﴿١٦﴾ يَتَجَرَّعُهُ
وَلَا يَكَادُ يُسِيغُهُ وَيَأْتِيهِ الْمَوْتُ مِنْ كُلِّ مَكَانٍ وَمَا هُوَ بِمَيِّتٍ وَمِنْ وَرَآئِهٖ عَذَابٌ غَلِيظٌ ﴿١٧﴾ مَثَلُ
الَّذِينَ كَفَرُوا بِرَبِّهِمْ اَعْمَالُهُمْ كَرَمَادٍ اشْتَدَّتْ بِهِ الرِّيحُ فِي يَوْمٍ عَاصِفٍ لَا يَقْدِرُونَ مِمَّا كَسَبُوا عَلٰى
شَيْءٍ ذٰلِكَ هُوَ الضَّلَالُ الْبَعِيدُ ﴿١٨﴾

---

*bu hədisi onlara da anlatdım. Allah-Təalaya şükür üçün hamımız səcdə etdik, dünyada zalımların başına bundan da böyük bəlalar gəlibdir. Amma ibrət götürən hanı?)*

**15)** (وَاسْتَفْتَحُوا) – (peyğəmbərlər Allah-Təaladan) **kömək istədilər,** (Allah-Təala da onlara kömək olub, zalımları əzabı ilə həlak edib peyğəmbərlərə nicat verdi). (وَخَابَ كُلُّ جَبَّارٍ عَنِيدٍ) – **hər bir təkəbbürlü** (və haqqa qarşı) **inadkar olanlar özlərinə** (zərər verib) **həlak oldular.** (Əməvi xəlifələrindən fasiq olan Vəlid ibn Yezid ibn Əbdülməlik bir gün Qurani-Şəriflə "istixarə" (baxıcılıq) etdi, bu ayə gəldi, dedi: sən mənə zülmkar, inadkar deyirsən? Quranı bir yerə qoyub əlinə kaman götürüb oxla vurub Quranı parça-parça etdi. Az bir müddət sonra camaat toplanıb, etdiyi günahlara görə onu parça-parça etdi. Allahın lənəti zalımların üzərinə olsun. Adları məlum olmayan peyğəmbərlərin və camaatların qissələri bitdi. Bundan sonra zalım şəxsin axirət əzabı bəyan edilir).

**16)** (مِنْ وَرَآئِهٖ جَهَنَّمُ) – (zalım şəxsin halı dünyada belə olub) **qabaqda da** (axirətdə) **ondan ötrü cəhənnəm vardır.** (وَيُسْقٰى مِنْ مَآءٍ صَدِيدٍ) – (zalım şəxsə orada cəhənnəm əhlinin bədənindən, ya da zinakar şəxslərin altlarından axan) **irinli-qanlı su içirdərlər.**

**17)** (يَتَجَرَّعُهُ) – (murdar suyu zorla) **qurtum-qurtum içməyə** (çalışar), (وَلَا يَكَادُ يُسِيغُهُ) - **amma udmağa müyəssər olmayıb** (boğazından keçirə bilməz). (Necə uda bilər?) (وَيَأْتِيهِ الْمَوْتُ مِنْ كُلِّ مَكَانٍ) – (sanki ölüm onu tutub) **hər bir tərəfdən ona ölüm gələr.** (وَمَا هُوَ بِمَيِّتٍ) - **amma ölən deyil,** (ki, o əzablardan xilas olsun, zalımlara heç vaxt ölüm yoxdur). (وَمِنْ وَرَآئِهٖ عَذَابٌ غَلِيظٌ) – **arxasınca da ondan ötrü şiddətli və çətin əzab vardır.** (Quran əhli zalımın əzabını düşünüb bu ayədən ibrət alsınlar).

**18)** (مَثَلُ الَّذِينَ كَفَرُوا بِرَبِّهِمْ) - **öz rəblərinə kafir olan şəxslərin məsəli** (belədir:) (اَعْمَالُهُمْ كَرَمَادٍ اشْتَدَّتْ بِهِ الرِّيحُ فِي يَوْمٍ عَاصِفٍ) – **onların küfr içində etdikləri xeyirli əməlləri fırtınalı gündə küləyin sovurub apardığı** (havaya qaldırıb məhv etdiyi) **gülə bənzəyir,** (necə ki bu gülün bir faydası yoxdur, onların da küfr içində etdikləri yaxşı əməllərinin də heç bir faydası yoxdur). (لَا يَقْدِرُونَ مِمَّا كَسَبُوا عَلٰى شَيْءٍ) – (qiyamət günündə dünyada) **qazandıqları əməllərin** (savabından) **heç bir şeyi əldə edə bilməzlər.** (ذٰلِكَ هُوَ الضَّلَالُ الْبَعِيدُ) – (haqdan) **uzaq olan zəlalət və asilik budur.**

اَلَمْ تَرَ اَنَّ اللّٰهَ خَلَقَ السَّمٰوَاتِ وَالْاَرْضَ بِالْحَقِّ ۜ اِنْ يَشَاْ يُذْهِبْكُمْ وَيَأْتِ بِخَلْقٍ جَدِيدٍۙ ﴿١٩﴾ وَمَا ذٰلِكَ عَلَى اللّٰهِ بِعَزِيزٍ ﴿٢٠﴾ وَبَرَزُوا لِلّٰهِ جَمِيعًا فَقَالَ الضُّعَفٰٓؤُا لِلَّذِينَ اسْتَكْبَرُوٓا اِنَّا كُنَّا لَكُمْ تَبَعًا فَهَلْ اَنْتُمْ مُغْنُونَ عَنَّا مِنْ عَذَابِ اللّٰهِ مِنْ شَيْءٍ قَالُوا لَوْ هَدٰينَا اللّٰهُ لَهَدَيْنَاكُمْ ۜ سَوَآءٌ عَلَيْنَآ اَجَزِعْنَآ اَمْ صَبَرْنَا مَا لَنَا مِنْ مَحِيصٍ ﴿٢١﴾ وَقَالَ الشَّيْطَانُ لَمَّا قُضِيَ الْاَمْرُ اِنَّ اللّٰهَ وَعَدَكُمْ وَعْدَ الْحَقِّ وَوَعَدْتُكُمْ فَاَخْلَفْتُكُمْ ۜ وَمَا كَانَ لِيَ عَلَيْكُمْ مِنْ سُلْطَانٍ اِلَّآ اَنْ دَعَوْتُكُمْ فَاسْتَجَبْتُمْ لِيۚ

---

**19)** (اَلَمْ تَرَ اَنَّ اللّٰهَ خَلَقَ السَّمٰوَاتِ وَالْاَرْضَ بِالْحَقِّ) – (ey insan), **bəs səmalara və yerə baxıb düşünmürsən ki, Allah-Təala bunları** (boş yerə yox) **bir hikmət üzrə yaradıb?**(اِنْ يَشَاْ يُذْهِبْكُمْ وَيَأْتِ بِخَلْقٍ جَدِيدٍ) - **əgər Allah-Təala istəsə, sizi** (yer üzündən götürüb) **əvəzinizə yeni bir məxluq gətirər.**

**20)** (وَمَا ذٰلِكَ عَلَى اللّٰهِ بِعَزِيزٍ) – **bu** (yer üzündən sizi götürüb əvəzinizə başqa məxluq gətirmək) **Allah-Təala üçün çətin və müşkül bir iş deyildir.** (Necə ki sizdən qabaq Ad, Səmud camaatını həlak edib, onların yerinə başqalarını gətirdi)**.**

**21)** (وَبَرَزُوا لِلّٰهِ جَمِيعًا) – (qiyamət günündə dünyada pis əməl edib əməllərini gizlədən şəxslərin) **hamısı Allah-Təalaya aşkar olub** (heç bir şey Ona məxfi qalmaz)**.** (فَقَالَ الضُّعَفٰٓؤُا لِلَّذِينَ اسْتَكْبَرُوٓا) – (qiyamət günündə) **zəif olanlar** (avamlar) **böyük** (təkəbbürlü, rəhbər) **olanlara deyərlər:** (اِنَّا كُنَّا لَكُمْ تَبَعًا) - **"Biz dünyada sizə tabe olub** (itaət edib nə hökm etdinizsə, ona əməl etdik)**,** (فَهَلْ اَنْتُمْ مُغْنُونَ عَنَّا مِنْ عَذَابِ اللّٰهِ مِنْ شَيْءٍ) - **indi siz də** (bizə kömək olub) **Allah-Təalanın əzabından az da olsa, bizi xilas edərsiniz?"** (قَالُوا لَوْ هَدٰينَا اللّٰهُ لَهَدَيْنَاكُمْ) – (rəislər avamların cavabında) **deyərlər: "Əgər Allah-Təala dünyada bizə hidayət edib** (haqqa qovuşdursaydı)**, biz də sizə hidayət edib** (haqqa qovuşdurardıq. Lakin Allah-Təala bizi zəlalətə saldı, biz də sizi zəlalətə saldıq. Xəbislər dünyada etdikləri küfr və zəlaləti Allah-Təalaya isnad etməklə nicat tapıb xilas olacaqlarını ümid edərlər)**.** (سَوَآءٌ عَلَيْنَآ اَجَزِعْنَآ اَمْ صَبَرْنَا مَا لَنَا مِنْ مَحِيصٍ) - (rəislər deyərlər:) **indi bizdən** (və sizdən) **ötrü eynidir,** (əzab içində) **ah-nalə edək, ya da səbir edək. Bizim üçün** (əzabdan) **qurtuluş yoxdur.** (Həmişə əzab içində olacağıq)**.**

**22)** (وَقَالَ الشَّيْطَانُ لَمَّا قُضِيَ الْاَمْرُ) - (xəbis və pis əməllərini şeytana isnad edib, özlərini pak hesab edənlər qiyamət günündə şeytanın dediyi sözə fikir versinlər. Qiyamət günündə) **hər bir iş** (haqq-hesab) **bitib** (cənnət və cəhənnəm əhli bir-birilərindən aralandıqda o vaxt) **şeytan** (cəhənnəm əhlinə xitab edib) **deyər:** (اِنَّ اللّٰهَ وَعَدَكُمْ وَعْدَ الْحَقِّ) – (ey Allah-Təalaya asi və kafir olanlar)**, həqiqətən, Allah-Təala sizə dünyada haqq olanı vəd etdi.** (Qiyamət günündə hər kəsə öz əməlinin cəzasını vermə vədinə də əməl etdi)**.** (وَوَعَدْتُكُمْ فَاَخْلَفْتُكُمْ) **- mən də sizə** (Allah-Təalanın vədinin xilafını) **vəd etdim. Amma** (vədimə vəfa etməyib) **xilaf çıxdım.** (وَمَا كَانَ لِيَ عَلَيْكُمْ مِنْ سُلْطَانٍ اِلَّآ اَنْ دَعَوْتُكُمْ فَاسْتَجَبْتُمْ لِي) **- mənim**

فَلَا تَلُومُونِي وَلُومُوٓا اَنْفُسَكُمْ ۘ مَآ اَنَا بِمُصْرِخِكُمْ وَمَآ اَنْتُمْ بِمُصْرِخِيَّ ۘ اِنِّي كَفَرْتُ بِمَآ اَشْرَكْتُمُونِ مِنْ قَبْلُ ۘ اِنَّ الظَّالِمِينَ لَهُمْ عَذَابٌ اَلِيمٌ ﴿٢٢﴾ وَاُدْخِلَ الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ جَنَّاتٍ تَجْرِي مِنْ تَحْتِهَا الْاَنْهَارُ خَالِدِينَ فِيهَا بِاِذْنِ رَبِّهِمْ ۘ تَحِيَّتُهُمْ فِيهَا سَلَامٌ ﴿٢٣﴾ اَلَمْ تَرَ كَيْفَ ضَرَبَ اللّٰهُ مَثَلًا كَلِمَةً طَيِّبَةً كَشَجَرَةٍ طَيِّبَةٍ

---

**sizin üzərinizdə heç bir hakimiyyətim yox idi** (ki, sizi zorla günaha vadar edim)**. Ancaq sizi** (küfr və günaha) **dəvət etmişəm. Siz də** (mənim dəvətimi) **qəbul edib** (küfr və günahı seçdiniz)**.** (فَلَا تَلُومُونِي وَلُومُوٓا اَنْفُسَكُمْ) – (bəs bu gündə) **məni məzəmmət etməyin, bəlkə, özünüzü məzəmmət edin.** (Çünki Allah-Təala sizi dəlil və sübut üzrə dəvət etdi, siz itaət etməyib üz döndərdiniz, mən isə dəlilsiz olaraq sizə vəsvəsə verdim və siz mənə itaət elədiniz)**.** (مَآ اَنَا بِمُصْرِخِكُمْ) – (şeytan deyir: "Bugünkü gündə mən sizin fəryadınıza çatıb Allah-Təalanın əzabından) **sizə nicat verən deyiləm.** (وَمَآ اَنْتُمْ بِمُصْرِخِيَّ) **- siz də** (mənim fəryadıma çatıb Allah-Təalanın əzabından) **mənə nicat verən deyilsiniz.** (اِنِّي كَفَرْتُ بِمَآ اَشْرَكْتُمُونِ مِنْ قَبْلُ) **- sizin bundan qabaq** (dünyada) **məni Allah-Təalaya şərik qoşmanızı** (bu gün) **inkar etdim."** (اِنَّ الظَّالِمِينَ لَهُمْ عَذَابٌ اَلِيمٌ) **-** (şeytan deyir:) **"Həqiqətən,** (bu günkü gündə*) **zalımlardan ötrü çox şiddətli əzab vardır."**

*(*Qeyd: Allah-Təalanın bu ayədə bu sözləri şeytandan nəql etməkdə məqsədi budur ki, bu sözləri eşidənlər fikir verib qiyamətdəki hallarını düşünsünlər, qiyamət günündə Allah-Təalanın hüzurunda duranda şeytanın dediyi sözləri düşünüb, dünyada etdikləri pis və xəbis əməlləri özlərindən kənar edib şeytana isnad etməsinlər və bunu da bilsinlər ki, hər bir əməl insanın özünə aid olub, onu başqasına isnad etmək Allah-Təalanın əzabından ona nicat verməz və dünyada arxayın olduqları şeydən (etdikləri pis əmələ görə şeytana, ya da başqalarına əzab olunacağından) ümidlərini kəsib, özlərinin cəzalandırılacaqlarını bilsinlər).*

**23)** (وَاُدْخِلَ الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ جَنَّاتٍ تَجْرِي مِنْ تَحْتِهَا الْاَنْهَارُ خَالِدِينَ فِيهَا بِاِذْنِ رَبِّهِمْ) – (Allah-Təalaya) **iman gətirib yaxşı əməl edənləri Allah-Təalanın izniylə axirət günündə** (qəsrlərinin və ağaclarının) **altından çaylar axan bağlara daxil edərlər. Orada həmişəlik qalıb çıxmazlar.** (تَحِيَّتُهُمْ فِيهَا سَلَامٌ) **- cənnət əhlinin salam** (və bəxşişləri Allah-Təala tərəfindən olan mələklərin) **onlara salam yetirməsidir.** (Allah-Təala tərəfindən mələklər gəlib cənnət əhlinə salam gətirərlər. Allah-Təalanın cənnət əhlinə salam göndərməsi cənnət və cənnətdə olan nemətlərdən daha yüksəkdir)**.**

**24)** (اَلَمْ تَرَ كَيْفَ ضَرَبَ اللّٰهُ مَثَلًا) – (ey Məhəmməd)**, bəs baxıb görmürsən ki, Allah-Təala sizdən ötrü necə məsəl çəkir?** ("la ilahə illəllah"ı kəlmeyi-tövhidi meyvə verən ağaca bənzədib, ondan ötrü ağacı misal çəkir. Necə ki buyurur:) (كَلِمَةً طَيِّبَةً كَشَجَرَةٍ طَيِّبَةٍ) – (xoş)**, pak olan kəlmə** (la ilahə illəllah

اَصْلُهَا ثَابِتٌ وَفَرْعُهَا فِي السَّمَٓاءِۙ ﴿٢٤﴾ تُؤْتٖٓي اُكُلَهَا كُلَّ حٖينٍ بِاِذْنِ رَبِّهَاۜ وَيَضْرِبُ اللّٰهُ الْاَمْثَالَ لِلنَّاسِ لَعَلَّهُمْ يَتَذَكَّرُونَ ﴿٢٥﴾ وَمَثَلُ كَلِمَةٍ خَبٖيثَةٍ كَشَجَرَةٍ خَبٖيثَةٍ اجْتُثَّتْ مِنْ فَوْقِ الْاَرْضِ مَا لَهَا مِنْ قَرَارٍ ﴿٢٦﴾ يُثَبِّتُ اللّٰهُ الَّذٖينَ اٰمَنُوا بِالْقَوْلِ الثَّابِتِ فِي الْحَيٰوةِ الدُّنْيَا وَفِي الْاٰخِرَةِۚ وَيُضِلُّ اللّٰهُ الظَّالِمٖينَ وَيَفْعَلُ اللّٰهُ مَا يَشَٓاءُ ﴿٢٧﴾ اَلَمْ تَرَ اِلَى الَّذٖينَ بَدَّلُوا نِعْمَتَ اللّٰهِ كُفْرًا وَاَحَلُّوا قَوْمَهُمْ دَارَ الْبَوَارِۙ ﴿٢٨﴾

---

kəlməsi) **pak** (gözəl meyvə verən) **ağac kimi olub** (Allah-Təala buna belə məsəl çəkir)**.** (اَصْلُهَا ثَابِتٌ وَفَرْعُهَا فِي السَّمَٓاءِ) – (o ağac elə ağacdır ki,) **onun əsli-kökü yerdə möhkəm sabit olub budaqları səmaya ucalmış olsun.**

**25)** (تُؤْتٖٓي اُكُلَهَا كُلَّ حٖينٍ بِاِذْنِ رَبِّهَا) **- o ağac öz rəbbi Allah-Təalanın izniylə hər zaman yaxşı** (dadlı) **meyvə verər.** (Belə meyvəli ağac nə qədər çox mənfəət verəndirsə, kəlmeyi-tövhidin mənfəət və faydası da qurtaran deyildir)**.** (وَيَضْرِبُ اللّٰهُ الْاَمْثَالَ لِلنَّاسِ لَعَلَّهُمْ يَتَذَكَّرُونَ) **- Allah-Təala insandan ötrü məsəllər çəkir ki, bəlkə o məsəllərin səbəbinə ibrət alıb,** (mənalarına diqqət edib Allah-Təalanın tövhid yolunu tapsınlar)**.**

**26)** (وَمَثَلُ كَلِمَةٍ خَبٖيثَةٍ) **- pis və xəbis olan kəlmənin** (Allah-Təalaya şərik qoşub kafir olmaq kəlməsi) **məsəli** (كَشَجَرَةٍ خَبٖيثَةٍ اجْتُثَّتْ مِنْ فَوْقِ الْاَرْضِ مَا لَهَا مِنْ قَرَارٍ) – (heç bir meyvəsi olmayıb)**, yer üzündən qoparılmış, əsli və kökü olmayan xəbis bir ağacın** (məsəli) **kimidir,** (necə ki bu ağacın meyvəsi olmayıb heç bir fayda vermir, habelə şirk və küfrün də heç bir faydası olmayıb, bəlkə sahibini həmişəlik əzaba düçar edib məhv edər)**.**

**27)** (يُثَبِّتُ اللّٰهُ الَّذٖينَ اٰمَنُوا بِالْقَوْلِ الثَّابِتِ) **- Allah-Təala möminləri möhkəm dəlil və sübutla sabit və bərqərar edər.** (فِي الْحَيٰوةِ الدُّنْيَا وَفِي الْاٰخِرَةِ) **– bu dünyada** (möminlər imanlarında sabit olub etiqad etdikləri tövhiddən vaz keçməzlər) **və axirətdə də** (Allah-Təalanın, məhşər əhlinin hüzurunda tövhidə möhkəm qəlb və açıq dəlillə şəhadət edərlər)**.** (وَيُضِلُّ اللّٰهُ الظَّالِمٖينَ) **- Allah-Təala zalımları zəlalətlərində qoyub** (onlardan ötrü nicat olmaz)**.** (وَيَفْعَلُ اللّٰهُ مَا يَشَٓاءُ) **– və Allah-Təala istədiyini** (hikmət və məsləhətə müvafiq olan şeyləri) **edər** (və heç kim ona mane ola bilməz)**.**

**28)** (اَلَمْ تَرَ اِلَى الَّذٖينَ بَدَّلُوا نِعْمَتَ اللّٰهِ كُفْرًا) - (ey Məhəmməd)**, bəs baxmırsan** (bu Məkkə əhlinin rəislərinə) **ki, Allah-Təalanın onlara verdiyi nemətə** (şükür etməyi) **dəyişib onun əvəzinə kafir oldular?** (Allah-Təala Məkkə əhlini öz hərəmində sakin edib onları Kəbənin baxıcısı təyin edib, özlərindən olan Hz. Məhəmmədi onlara peyğəmbər göndərib, bu nemətlərə şükür etmək əvəzinə kafir oldular)**.** (وَاَحَلُّوا قَوْمَهُمْ دَارَ الْبَوَارِ) – (o rəislər özlərini əzaba salmaqdan başqa) **qövm və camaatlarını da** (əzab və) **ölümə düçar etdilər.**

جَهَنَّمَۚ يَصْلَوْنَهَاۜ وَبِئْسَ الْقَرَارُ ﴿٢٩﴾ وَجَعَلُوا لِلّٰهِ اَنْدَادًا لِيُضِلُّوا عَنْ سَبِيلِهٖۜ قُلْ تَمَتَّعُوا فَاِنَّ مَصِيرَكُمْ
اِلَى النَّارِ ﴿٣٠﴾ قُلْ لِعِبَادِيَ الَّذِينَ اٰمَنُوا يُقِيمُوا الصَّلٰوةَ وَيُنْفِقُوا مِمَّا رَزَقْنَاهُمْ سِرًّا وَعَلَانِيَةً مِنْ قَبْلِ
اَنْ يَأْتِيَ يَوْمٌ لَا بَيْعٌ فِيهِ وَلَا خِلَالٌ ﴿٣١﴾ اَللّٰهُ الَّذِي خَلَقَ السَّمٰوَاتِ وَالْاَرْضَ وَاَنْزَلَ مِنَ السَّمَاۤءِ
مَاۤءً فَاَخْرَجَ بِهٖ مِنَ الثَّمَرَاتِ رِزْقًا لَكُمْۚ وَسَخَّرَ لَكُمُ الْفُلْكَ لِتَجْرِيَ فِي الْبَحْرِ بِاَمْرِهٖۚ وَسَخَّرَ لَكُمُ
الْاَنْهَارَۚ ﴿٣٢﴾ وَسَخَّرَ لَكُمُ الشَّمْسَ وَالْقَمَرَ دَآئِبَيْنِۚ وَسَخَّرَ لَكُمُ الَّيْلَ وَالنَّهَارَۚ ﴿٣٣﴾ وَاٰتٰيكُمْ مِنْ
كُلِّ مَا سَاَلْتُمُوهُۜ

---

**29)** (جَهَنَّمَ يَصْلَوْنَهَا) – (o əzab evi cəhənnəmdir, əzabdan ötrü) **oraya daxil olacaqlar,** (وَبِئْسَ الْقَرَارُ) **– ora nə pis sığınacaqdır.**

**30)** (وَجَعَلُوا لِلّٰهِ اَنْدَادًا لِيُضِلُّوا عَنْ سَبِيلِهٖ) – (bu müşriklər bütləri) **Allah-Təalaya şərik qoşdular ki,** (digər insanları da) **Allah-Təala yolundan zəlalətə salıb** (şirkə düçar etsinlər). (قُلْ تَمَتَّعُوا) **- (ey Məhəmməd, onlara) de ki,** (Allah-Təalaya şərik qoşmaqla, dünya həyatında bir neçə gün bütpərəstlikdən) **ləzzət alın.** (فَاِنَّ مَصِيرَكُمْ اِلَى النَّارِ) **- həqiqətən,** (dünyadan köçəndən sonra) **sizin qayıdacaq yeriniz cəhənnəmin odudur.** (Sizdən ötrü oradan nicat olmayacaqdır)**.**

**31)** (قُلْ لِعِبَادِيَ الَّذِينَ اٰمَنُوا يُقِيمُوا الصَّلٰوةَ) **-** (ey Məhəmməd)**, mənim iman gətirən bəndələrimə de ki, namazı** (vaxtında) **qılıb tərk etməsinlər.** (وَيُنْفِقُوا مِمَّا رَزَقْنَاهُمْ سِرًّا وَعَلَانِيَةً) **– bizim onlara verdiyimiz ruzilərdən** (Allah yolunda) **gizlində və aşkarda sədəqə və ehsan etsinlər.** (مِنْ قَبْلِ اَنْ يَأْتِيَ يَوْمٌ لَا بَيْعٌ فِيهِ وَلَا خِلَالٌ) **- alış-veriş və dostluğun olmayacağı bir gündən** (qiyamətdən) **öncə** (Allah rizası üçün sədəqə və ehsan verin ki, axirətdə onun əvəzini alasınız. Çünki axirətdə alış-veriş və dostluq olmaz)**.**

**32)** (اَللّٰهُ الَّذِي خَلَقَ السَّمٰوَاتِ وَالْاَرْضَ) **- Allah-Təala səmaları və yeri yaratdı.** (وَاَنْزَلَ مِنَ السَّمَاۤءِ مَاۤءً) – (ondan sonra) **səmadan su göndərdi.** (فَاَخْرَجَ بِهٖ مِنَ الثَّمَرَاتِ رِزْقًا لَكُمْ) – (o suyun səbəbinə) **sizin üçün ruzi olaraq meyvələri yetişdirdi,** (وَسَخَّرَ لَكُمُ الْفُلْكَ لِتَجْرِيَ فِي الْبَحْرِ بِاَمْرِهٖ) **- və** (Allah-Təalanın sizə verdiyi ağıl səbəbilə) **gəmiləri sizə tabe etdi ki, Allah-Təalanın əmriylə dənizdə üzüb** (ticarət edəsiniz)**.** (وَسَخَّرَ لَكُمُ الْاَنْهَارَ) **- və** (yer üzündə axan) **çayları sizə tabe etdi** (ki, o çay vasitəsilə əkin-biçin işlərinizi görəsiniz)**.**

**33)** (وَسَخَّرَ لَكُمُ الشَّمْسَ وَالْقَمَرَ دَآئِبَيْنِ) – (Allah-Təala daim öz orbitində) **seyr edən günəşi və ayı sizə tabe edib,** (yer üzünü nurlandırıb, onunla bütün heyvanata, bitkilərə, əşyalara təsir edər). (وَسَخَّرَ لَكُمُ الَّيْلَ وَالنَّهَارَ) **- gecəni və gündüzü sizə tabe etdi** (ki, gecələr rahat olub gündüzlər məişətinizlə məşğul olasınız)**.**

**34)** (وَاٰتٰيكُمْ مِنْ كُلِّ مَا سَاَلْتُمُوهُ) – (Allah-Təala öz lütf və rəhmətilə ehtiyacınız olan)**, istədiyiniz şeylərin hamısını sizə bəxş etdi.** (Əgər o şeylər olmasay-

وَاِنْ تَعُدُّوا نِعْمَتَ اللّٰهِ لَا تُحْصُوهَاۜ اِنَّ الْاِنْسَانَ لَظَلُومٌ كَفَّارٌ ﴿٣٤﴾ وَاِذْ قَالَ اِبْرٰهِيمُ رَبِّ اجْعَلْ هٰذَا الْبَلَدَ اٰمِنًا وَاجْنُبْنِي وَبَنِيَّ اَنْ نَعْبُدَ الْاَصْنَامَۜ ﴿٣٥﴾ رَبِّ اِنَّهُنَّ اَضْلَلْنَ كَث۪يرًا مِنَ النَّاسِۚ فَمَنْ تَبِعَن۪ي فَاِنَّهُ مِنّ۪يۚ وَمَنْ عَصَان۪ي فَاِنَّكَ غَفُورٌ رَح۪يمٌ ﴿٣٦﴾

---

dı, hər halda ehtiyac içində qalıb dilənərdiniz). (وَاِنْ تَعُدُّوا نِعْمَتَ اللّٰهِ لَا تُحْصُوهَا) – (əgər siz insanlar) **Allah-Təalanın nemətlərini** (müxtəsər də olsa) **saymaq istəsəniz, saya bilməzsiniz,** (sizdə o qüdrət yoxdur və Allah-Təalanın nemətlərini saymaq imkansızdır. Hətta bir loğma çörəkdə olan nemətləri saymağa da bir neçə ömür lazımdır ki, ondan ötrü kitablar yazılsın. Allahın neməti və ehsanı nə ucadır). (اِنَّ الْاِنْسَانَ لَظَلُومٌ كَفَّارٌ) - **həqiqətən, insan** (Allah-Təalanın nemətlərinə şükür etməyən) **zalım və nankordur.**

(Hz. İbrahim Allah-Təala tərəfindən Kəbəni tikməklə vəzifələndirildi. Hz. İbrahim Fələstin tərəfdə Kənanda olurdu. Oradan oğlu İsmayılı götürüb getdi. Hicazda quru dağların arasında Kəbəni tikdi. Ondan sonra oğlu İsmayılı anası Həcərlə orada məskun edib Şama qayıtdı. Hz. İsmayıl Zəmzəm quyusunu qazanda orada su göründü. Bəni-Cürhüm qəbiləsi Ərəfatdan keçəndə Kəbənin ətrafında uçan quşlardan orada su olduğunu anlayıb, Məkkəyə gəldilər. Hz. İsmayıl və Həcərlə ünsiyyət qurub orada qaldılar. Hz. İsmayıl o qəbilədən evlənib övlad sahibi oldu. Hz. İsmayılın nəsli çoxalıb, özündən sonra Kəbədə ixtiyar sahibi oldu. Ta o vaxta kimi ki, yeganə parlaq ulduz olan Hz. Məhəmməd (ə.s), Hz. İsmayılın nəslindən olan Abdullah ibn Əbdül-Müttəlibdən dünyaya gəlib, hənif dini olan islamı dünyaya yaydı. Fəxr olsun islama və ar olsun müsəlmanlara. Hz. İbrahimin İsmayılı Məkkədə qoyub gedən zaman etdiyi dualar bu ayələrdə zikr olunur).

**35)** (وَاِذْ قَالَ اِبْرٰهِيمُ) – (Hz. İsmayıl və anası Həcəri) **İbrahim** (Məkkədə qoyub gedən zaman Allah-Təalaya dua edib) **dedi:** (رَبِّ اجْعَلْ هٰذَا الْبَلَدَ اٰمِنًا) - **"Ey mənim rəbbim, sən bu** (Məkkə) **diyarını əmin bir yer et** (ki, insanlar orada arxayınlıq içində olsunlar. Allah-Təala Hz. İbrahimin bu duasına görə Məkkəni və ətrafını hərəm (haram, hörmətli) elan etdi. Cəmi insan və heyvanlar gərək orada əmin-amanlıqda olsunlar). (وَاجْنُبْنِي وَبَنِيَّ اَنْ نَعْبُدَ الْاَصْنَامَ) – (ey mənim rəbbim)**, mənim özümü və oğullarımı bütə sitayiş edib** (bütpərəst olmaqdan) **kənar et.**

**36)** (رَبِّ اِنَّهُنَّ اَضْلَلْنَ كَث۪يرًا مِنَ النَّاسِ) - **ey mənim rəbbim, o bütlər insanlardan bir çoxunu zəlalətə** (haqq yolundan kənara) **salıb.** (İnsanlar bütlərin səbəbinə asi olduqlarından bunun səbəbini bütlərin özlərinə isnad edir). (فَمَنْ تَبِعَن۪ي فَاِنَّهُ مِنّ۪ي) - **kim mənə tabe olub** (mənim dinimdən olsa)**, o şəxs məndən,** (bədənimdən bir hissədir). (وَمَنْ عَصَان۪ي) – **və kim mənə asi olub itaətimdən çıxsa,** (فَاِنَّكَ غَفُورٌ رَح۪يمٌ)

رَبَّنَآ اِنّيٓ اَسْكَنْتُ مِنْ ذُرِّيَّتي بِوَادٍ غَيْرِ ذي زَرْعٍ عِنْدَ بَيْتِكَ الْمُحَرَّمِۙ رَبَّنَا لِيُقيمُوا الصَّلٰوةَ فَاجْعَلْ اَفْئِدَةً
مِنَ النَّاسِ تَهْوٓي اِلَيْهِمْ وَارْزُقْهُمْ مِنَ الثَّمَرَاتِ لَعَلَّهُمْ يَشْكُرُونَ ﴿٣٧﴾ رَبَّنَآ اِنَّكَ تَعْلَمُ مَا نُخْفي وَمَا
نُعْلِنُۜ وَمَا يَخْفٰى عَلَى اللّٰهِ مِنْ شَيْءٍ فِي الْاَرْضِ وَلَا فِي السَّمَآءِ ﴿٣٨﴾ اَلْحَمْدُ لِلّٰهِ الَّذي وَهَبَ لي
عَلَى الْكِبَرِ اِسْمٰعيلَ وَاِسْحٰقَۜ اِنَّ رَبّي لَسَميعُ الدُّعَآءِ ﴿٣٩﴾ رَبِّ اجْعَلْني مُقيمَ الصَّلٰوةِ وَمِنْ ذُرِّيَّتيۗ
رَبَّنَا وَتَقَبَّلْ دُعَآءِ ﴿٤٠﴾

---

**- həqiqətən, asiləri bağışlayıb rəhm edən sənsən.** (Necə də ədəbə gözəl riayət edib danışır, Hz. İbrahim kimi şəxs gərək belə danışsın)**.**

**37)** (رَبَّنَآ اِنّيٓ اَسْكَنْتُ مِنْ ذُرِّيَّتي بِوَادٍ غَيْرِ ذي زَرْعٍ عِنْدَ بَيْتِكَ الْمُحَرَّمِ) **– ey bizim rəbbimiz,** (bu məqamda İsmayıldan ötrü dua etdiyi üçün İsmayılı da özünə yoldaş edib, - bizim rəbbimiz, deyir)**, həqiqətən, mən övladlarımdan bəzisini** (İsmayılı dağların arasında) **əkin yeri olmayan bu çöldə** (vadidə)**, sənin hörmətli evinin** (Kəbənin) **yanında məskun etdim** (رَبَّنَا لِيُقيمُوا الصَّلٰوةَ) **- ki, ey rəbbimiz,** (İsmayıl özü və nəsli) **burada namaz qılıb** (sənə ibadət və itaət etmək səbəbinə bu evi abadlaşdırsınlar)**.** (فَاجْعَلْ اَفْئِدَةً مِنَ النَّاسِ تَهْوٓي اِلَيْهِمْ) **– insanlardan bir qisminin** (qəlbini) **bunlara meyil etdir ki,** (şövq və sürətlə bunların yanına - Məkkəyə gəlsinlər)**.** (وَارْزُقْهُمْ مِنَ الثَّمَرَاتِ لَعَلَّهُمْ يَشْكُرُونَ) – (Məkkədə olan bu camaata) **hər cür meyvələrdən ruzi ver ki, bəlkə** (bu ruzi səbəbinə nemətə) **şükür etsinlər,** (Allah-Təala Hz. İbrahimin duasını qəbul edib, hər zaman Məkkədə meyvə bolluğu olub, susuz, otsuz olan Məkkə bu səbəbə bol meyvəli firavan bir şəhər oldu. Bəs bu Allah-Təalanın təəccüblü dəlil və əlamətlərindən deyilmi?)

**38)** (رَبَّنَآ اِنَّكَ تَعْلَمُ مَا نُخْفي وَمَا نُعْلِنُ) **- ey bizim rəbbimiz, həqiqətən, sən gizlətdiyimiz və aşkar etdiyimiz hər şeyə** (zahir və batinə, əhvalımıza, xeyir və zərərimizə bizdən daha çox) **agahsan.** (Dua edib sənə yalvarmağa heç bir ehtiyac yoxdur. Bu, ancaq bəndə və qul olmağımızı izhar etməkdən ötrüdür)**.** (وَمَا يَخْفٰى عَلَى اللّٰهِ مِنْ شَيْءٍ فِي الْاَرْضِ وَلَا فِي السَّمَآءِ) (Hz. İbrahim yenə deyir:) **- yerdə və səmalarda olan heç bir şey Allah-Təalaya məxfi qalmaz.**

**39)** (اَلْحَمْدُ لِلّٰهِ الَّذي وَهَبَ لي عَلَى الْكِبَرِ اِسْمٰعيلَ وَاِسْحٰقَ) **- Allah-Təalaya həmd edirəm ki, qoca halımda İsmayıl və İshaqı mənə bağışlayıb bəxş etdi.** (اِنَّ رَبّي لَسَميعُ الدُّعَآءِ) **- həqiqətən, mənim rəbbim duanı eşidib qəbul edəndir.** (Necə ki mənim duamı eşidib qoca vaxtımda mənə övlad verdi)**.**

**40)** (رَبِّ اجْعَلْني مُقيمَ الصَّلٰوةِ وَمِنْ ذُرِّيَّتي) - (İbrahim deyir:) **ey mənim rəbbim, məni və nəslimdən olanları namazı** (vaxtlı-vaxtında, ədəb-ərkanla) **qılanlardan et.** (رَبَّنَا وَتَقَبَّلْ دُعَآءِ) **- ey bizim rəbbimiz, dualarımı qəbul et.**

رَبَّنَا اغْفِرْ لِي وَلِوَالِدَيَّ وَلِلْمُؤْمِنِينَ يَوْمَ يَقُومُ الْحِسَابُ ﴿٤١﴾ وَلَا تَحْسَبَنَّ اللّٰهَ غَافِلًا عَمَّا يَعْمَلُ
الظَّالِمُونَ اِنَّمَا يُؤَخِّرُهُمْ لِيَوْمٍ تَشْخَصُ فِيهِ الْاَبْصَارُ ﴿٤٢﴾ مُهْطِعِينَ مُقْنِعِي رُؤُسِهِمْ لَا يَرْتَدُّ اِلَيْهِمْ
طَرْفُهُمْ وَاَفْـِٔدَتُهُمْ هَوَاءٌ ﴿٤٣﴾ وَاَنْذِرِ النَّاسَ يَوْمَ يَأْتِيهِمُ الْعَذَابُ فَيَقُولُ الَّذِينَ ظَلَمُوا رَبَّنَا اَخِّرْنَا
اِلٰى اَجَلٍ قَرِيبٍ نُجِبْ دَعْوَتَكَ وَنَتَّبِعِ الرُّسُلَ اَوَلَمْ تَكُونُوا اَقْسَمْتُمْ مِنْ قَبْلُ مَا لَكُمْ مِنْ زَوَالٍ ﴿٤٤﴾
وَسَكَنْتُمْ فِي مَسَاكِنِ الَّذِينَ ظَلَمُوا اَنْفُسَهُمْ وَتَبَيَّنَ لَكُمْ كَيْفَ فَعَلْنَا بِهِمْ

---

**41)** (رَبَّنَا اغْفِرْ لِي وَلِوَالِدَيَّ وَلِلْمُؤْمِنِينَ يَوْمَ يَقُومُ الْحِسَابُ) - (İbrahim deyir:) **ey bizim rəbbimiz, haqq-hesab çəkilən gün məni, ata-anamı və möminləri bağışla.** (Hz. İbrahimin ata-anası müşrik olduğuna görə, Allah-Təala onun ata və anası haqda olan duasını qəbul etmədi, necə ki keçən Tövbə surəsində də bunu xəbər vermişdi. Hz. İbrahimin duası bitdi)**.**

**42)** (وَلَا تَحْسَبَنَّ اللّٰهَ غَافِلًا عَمَّا يَعْمَلُ الظَّالِمُونَ) - (ey Məhəmməd)**, Allah-Təalanın zalımların əməllərindən qafil olduğunu güman etmə.** (Heç vaxt Allah-Təala onlardan qafil olmaz)**.** (اِنَّمَا يُؤَخِّرُهُمْ لِيَوْمٍ تَشْخَصُ فِيهِ الْاَبْصَارُ) **- həqiqətən,** (Allah-Təala zalımların) **əzabını elə bir günə təxirə salar ki, o günün** (qiyamət günü) **qorxusundan gözləri hədəqədən çıxıb** (kirpik qırpmağa da qüdrətləri olmaz)**.**

**43)** (مُهْطِعِينَ) – (qiyamət günü o zalımlar Allah tərəfindən çağıranın tərəfinə) **sürətlə gedərlər.** (مُقْنِعِي رُؤُسِهِمْ) **- başlarını yuxarı qaldırdıqları bir halda** (لَا يَرْتَدُّ اِلَيْهِمْ طَرْفُهُمْ) – (şiddətli qorxudan gözləri açıq qalıb) **özlərinə baxa bilməyib kirpik də qırpa bilməzlər.** (وَاَفْـِٔدَتُهُمْ هَوَاءٌ) **- qəlbləri də** (şiddətli qorxudan) **bomboş olar.**

**44)** (وَاَنْذِرِ النَّاسَ يَوْمَ يَأْتِيهِمُ الْعَذَابُ) - (ey Məhəmməd)**, xalqı o gündən qorxut ki, o gün** (qiyamət günü) **onlara əzab gəldiyində** (o əzabdan onları qurtarıb xilas edən olmaz)**.** (فَيَقُولُ الَّذِينَ ظَلَمُوا) – (o günün əzabını gördükdə)**, zalımlar deyərlər:** (رَبَّنَا اَخِّرْنَا اِلٰى اَجَلٍ قَرِيبٍ) **- ey bizim rəbbimiz,** (bizi dünyaya qaytarıb əzabımızı təxirə salıb) **bizə bir az möhlət ver** (ki, axirət tədarükünü görüb saleh əməl edək)**.** (نُجِبْ دَعْوَتَكَ وَنَتَّبِعِ الرُّسُلَ) **- sənin dəvətini qəbul edib peyğəmbərlərə tabe olaq.** (اَوَلَمْ تَكُونُوا اَقْسَمْتُمْ مِنْ قَبْلُ مَا لَكُمْ مِنْ زَوَالٍ) - (Allah-Təala zalımların cavabında deyər:) **bəs siz** (zalımlar) **deyildiniz ki, bundan qabaq** (dünyada) **and içib deyirdiniz ki,** (dünyada) **sizə zaval** (axirətə getmək) **yoxdur.** (Bugünkü günü inkar edirdiniz, indi siz əgər dünyaya qayıtsanız, yenə həmin sözləri deyəcəksiniz.

**45)** (وَسَكَنْتُمْ فِي مَسَاكِنِ الَّذِينَ ظَلَمُوا اَنْفُسَهُمْ) **- siz** (zalımlar sizdən qabaq) **özlərinə zalım olan şəxslərin məskun olduğu yerlərdə sakin oldunuz.** (وَتَبَيَّنَ لَكُمْ كَيْفَ فَعَلْنَا بِهِمْ) – (onların xəbərləri sizə yetişməklə) **sizdən ötrü aşkar oldu ki, biz**

وَضَرَبْنَا لَكُمُ الْاَمْثَالَ ﴿٤٥﴾ وَقَدْ مَكَرُوا مَكْرَهُمْ وَعِنْدَ اللّٰهِ مَكْرُهُمْ ۜ وَاِنْ كَانَ مَكْرُهُمْ لِتَزُولَ مِنْهُ
الْجِبَالُ ﴿٤٦﴾ فَلَا تَحْسَبَنَّ اللّٰهَ مُخْلِفَ وَعْدِهٖ رُسُلَهُ ۜ اِنَّ اللّٰهَ عَزِيزٌ ذُو انْتِقَامٍ ﴿٤٧﴾ يَوْمَ تُبَدَّلُ
الْاَرْضُ غَيْرَ الْاَرْضِ وَالسَّمٰوَاتُ وَبَرَزُوا لِلّٰهِ الْوَاحِدِ الْقَهَّارِ ﴿٤٨﴾ وَتَرَى الْمُجْرِمِينَ يَوْمَئِذٍ مُقَرَّنِينَ
فِي الْاَصْفَادِ ﴿٤٩﴾ سَرَابِيلُهُمْ مِنْ قَطِرَانٍ وَتَغْشٰى وُجُوهَهُمُ النَّارُ ۙ ﴿٥٠﴾

---

**onları zülmlərinin səbəbinə necə həlak edib onlardan necə intiqam aldıq.** (وَضَرَبْنَا لَكُمُ الْاَمْثَالَ) – (zalımların qəribə sifətlərini) **məsəllər kimi sizdən ötrü bəyan etdik** (ki, onlardan ibrət alasınız, lakin siz onlardan ibrət almayıb onlar kimi zalım oldunuz. İndi bu gün qiyamət günündə hər bir tərəfdən naümid olub dünyaya qayıtmağı arzu edirsiniz. Dünyaya qayıtmaq imkansızdır)**.**

**46)** (وَقَدْ مَكَرُوا مَكْرَهُمْ) **- həqiqətən,** (zalımlar peyğəmbərlərin barəsində böyük) **məkr və hiylələr etdilər.** (Amma axırda Allah-Təalanın din və peyğəmbəri onlara qalib oldu) (وَعِنْدَ اللّٰهِ مَكْرُهُمْ) **- onların məkr və hiylələri Allah-Təala yanında sabit və bərqərardır.** (Məkrlərinin cəzasını verəcəkdir)**.** (وَاِنْ كَانَ مَكْرُهُمْ لِتَزُولَ مِنْهُ الْجِبَالُ) **– hərçənd onların məkr və hiylələri elə böyükdür ki, az qalır ki, dağlara təsir edib yerindən hərəkət etdirsin.** (Bununla belə Allah-Təala onların böyük olan məkrlərinə qalib olub onları zəif və zəlil etdi)**.**

**47)** (فَلَا تَحْسَبَنَّ اللّٰهَ مُخْلِفَ وَعْدِهٖ رُسُلَهُ) **-** (ey Məhəmməd)**, güman etmə ki, Allah-Təala peyğəmbərlərinə verdiyi vədin xilafını edər.** (Sənə də Allah-Təala vəd edibdir ki, səni düşmənə qalib etsin, vədinə sadiq olacaqdır.) (اِنَّ اللّٰهَ عَزِيزٌ ذُو انْتِقَامٍ) **- həqiqətən, Allah-Təala** (məxluqatına) **qalib olub** (zalımlardan) **intiqam alandır.**

**48)** (يَوْمَ تُبَدَّلُ الْاَرْضُ غَيْرَ الْاَرْضِ وَالسَّمٰوَاتُ) **–** (qiyamət günü) **elə bir gündür ki, bu yer dəyişilib başqa bir yerlə əvəz olunar, habelə səmalar da dəyişib** (günəş, ay, ulduzlar qaralıb məhv olar)**.** (وَبَرَزُوا لِلّٰهِ الْوَاحِدِ الْقَهَّارِ) **- bütün məxluqat** (qəbirlərindən çıxıb, məxluqata) **qalib olan yeganə Allah-Təalanın hökmüylə** (haqq-hesabdan ötrü məhşərdə) **hazır olarlar.**

**49)** (وَتَرَى الْمُجْرِمِينَ يَوْمَئِذٍ مُقَرَّنِينَ فِي الْاَصْفَادِ) **-** (ey Məhəmməd)**, qiyamət günündə asi və müşrikləri görərsən ki, hamısı bir-biriylə zəncirə bağlanıb** (əzabdan ötrü cəhənnəmə aparılır)**.**

**50)** (سَرَابِيلُهُمْ مِنْ قَطِرَانٍ) **- onların köynəkləri * qətrandan olar.** (وَتَغْشٰى وُجُوهَهُمُ النَّارُ) **- onların üzlərini atəş bürüyüb** (üzlərini qorumağa qadir olmazlar)**.**

*(*Qeyd: Qətran ardıc ağacından çıxan yağdır. Sürətlə alışar, qotur dəvəyə sürtərlər. Qoturluğu yandırır. O ağac Ərəbistanda olur. Guya qiyamət günü asilərin bədəninə köynək əvəzinə qətran sürtərlər ki, daha da yanmağa kömək etsin).*

لِيَجْزِيَ اللّٰهُ كُلَّ نَفْسٍ مَا كَسَبَتْ ۜ اِنَّ اللّٰهَ سَرِيعُ الْحِسَابِ ﴿٥١﴾ هٰذَا بَلَاغٌ لِلنَّاسِ وَلِيُنْذَرُوا بِهٖ
وَلِيَعْلَمُوٓا اَنَّمَا هُوَ اِلٰهٌ وَاحِدٌ وَلِيَذَّكَّرَ اُولُوا الْاَلْبَابِ ﴿٥٢﴾

---

**51)** (لِيَجْزِيَ اللّٰهُ كُلَّ نَفْسٍ مَا كَسَبَتْ) **- Allah-Təala** (zalımlara bu əzabları edər ki,) **hər kəsin elədiyi əməlinin cəzasını özünə versin.** (اِنَّ اللّٰهَ سَرِيعُ الْحِسَابِ) **- həqiqətən, Allah-Təala** (qiyamət günündə sürətlə) **tezliklə haqq-hesab çəkəndir.** (Tezliklə haqq-hesab edib məzlumun intiqamını zalımdan alacaqdır)**.**

**52)** (هٰذَا بَلَاغٌ لِلنَّاسِ) **- bu** (qeyd olunan zalımların əzabı öyüd qəbul edən) **insanlardan ötrü nəsihətdir.** (وَلِيُنْذَرُوا بِهٖ) **- gərək** (bu nəsihəti qəbul edib Allah-Təalanın) **əzabından qorxsunlar.** (وَلِيَعْلَمُوٓا اَنَّمَا هُوَ اِلٰهٌ وَاحِدٌ) – (Allah-Təalanın tövhidinə dair qeyd olunan dəlilləri düşünüb) **agah olsunlar ki, haqq olan məbud yeganə Allah-Təaladır.** (Ondan başqa məbudlar batildir)**.** (وَلِيَذَّكَّرَ اُولُوا الْاَلْبَابِ) **- əlbəttə, gərək ağıl sahibləri ibrət alıb,** (bu öyüd-nəsihəti qəbul etsinlər)**.**

Allaha həmd olsun, İbrahim surəsinin təfsiri bitdi. Bu mübarək surə asi və günahkarlar üçün öyüd-nəsihət olmaqda kifayət edər. Hz. Peyğəmbər buyurubdur: *"İbrahim surəsini kim oxusa, Allah-Təala ona 10 savab bəxş edər."*



## əl-HİCR SURƏSİ

15-ci surədir. Məkkədə nazil olub, 99 ayə, 654 kəlmə, 2760 hərfdir.



بِسْمِ اللهِ الرَّحْمٰنِ الرَّحِيمِ. الٓرٰ تِلْكَ اٰيَاتُ الْكِتَابِ وَقُرْاٰنٍ مُبِينٍ ﴿١﴾ رُبَمَا يَوَدُّ الَّذِينَ كَفَرُوا لَوْ كَانُوا مُسْلِمِينَ ﴿٢﴾ ذَرْهُمْ يَأْكُلُوا وَيَتَمَتَّعُوا وَيُلْهِهِمُ الْاَمَلُ فَسَوْفَ يَعْلَمُونَ ﴿٣﴾ وَمَٓا اَهْلَكْنَا مِنْ قَرْيَةٍ اِلَّا وَلَهَا كِتَابٌ مَعْلُومٌ ﴿٤﴾ مَا تَسْبِقُ مِنْ اُمَّةٍ اَجَلَهَا وَمَا يَسْتَأْخِرُونَ ﴿٥﴾ وَقَالُوا يَٓا اَيُّهَا الَّذِي نُزِّلَ عَلَيْهِ الذِّكْرُ اِنَّكَ لَمَجْنُونٌ ﴿٦﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1)** (الٓرٰ) **surəsidir.** (تِلْكَ اٰيَاتُ الْكِتَابِ وَقُرْاٰنٍ مُبِينٍ) **- bu surədə zikr olunan ayələr kamil və aşkar** (dəlil) **olan Quranın ayələridir.**

**2)** (رُبَمَا يَوَدُّ الَّذِينَ كَفَرُوا لَوْ كَانُوا مُسْلِمِينَ) **- çox vaxt kafirlər istərlər ki, o vaxt** (ölən vaxtı) **kaş müsəlman** (müvəhhid) **olaydılar.** (Hər kəs ölən vaxtı axirətdəki dərəcəsini bildiyinə görə, kafir və müşriklər arzu edərlər ki, kaş müsəlman (müvəhhid) olub o əzablardan xilas olaydılar)**.**

**3)** (ذَرْهُمْ يَأْكُلُوا وَيَتَمَتَّعُوا) **-** (ey Məhəmməd, sən bu kafirləri nə qədər imana dəvət etsən də, iman gətirən deyillər)**. Qoy** (bu kafirlər dünyada bir müddət) **yeyib ləzzət alsınlar,** (onların imanından ümidini kəs)**.** (وَيُلْهِهِمُ الْاَمَلُ) **- onların** (dünyadakı) **arzuları onların** (Allah-Təalaya iman gətirməsinə mane olub) **məşğul edər.** (فَسَوْفَ يَعْلَمُونَ) **– tezliklə** (öləndən sonra öz əməllərinin pisliyini bilib haqdan kənar olduqlarından) **agah olarlar.**

**4)** (وَمَٓا اَهْلَكْنَا مِنْ قَرْيَةٍ اِلَّا وَلَهَا كِتَابٌ مَعْلُومٌ) **– biz heç bir məmləkətin əhlini** (Allah-Təala yanında) **bilinən müəyyən bir vaxtı olmadan həlak etməmişik,** (qeyd olunan o vaxt gecikməz, həmin vaxt onlara əzab nazil olunar)**.**

**5)** (مَا تَسْبِقُ مِنْ اُمَّةٍ اَجَلَهَا وَمَا يَسْتَأْخِرُونَ) **- heç bir ümmət həlakını** (vaxtından əvvəl) **nə qabağa çəkə bilər və nə də təxirə salar,** (vaxtında həlak olarlar. Ey Məhəmməd, sənə istehza edən bu Məkkə əhlindən ötrü də müəyyən bir vaxt vardır. O müəyyən vaxtda məğlub və həlak olacaqlar. O müəyyən vaxt Bədir günü oldu)**.**

**6)** (وَقَالُوا يَٓا اَيُّهَا الَّذِي نُزِّلَ عَلَيْهِ الذِّكْرُ اِنَّكَ لَمَجْنُونٌ) **-** (ey Məhəmməd, bu Qüreyş camaatı sənə istehza edib) **dedi:** (ey Məhəmməd)**, ey özünə Quran nazil olan,** (ey bunu iddia edən)**, həqiqətən sən* dəlisən.**

لَوْ مَا تَأْتِينَا بِالْمَلٰٓئِكَةِ اِنْ كُنْتَ مِنَ الصَّادِقِينَ ﴿٧﴾ مَا نُنَزِّلُ الْمَلٰٓئِكَةَ اِلَّا بِالْحَقِّ وَمَا كَانُوٓا اِذًا مُنْظَرِينَ
﴿٨﴾ اِنَّا نَحْنُ نَزَّلْنَا الذِّكْرَ وَاِنَّا لَهُ لَحَافِظُونَ ﴿٩﴾ وَلَقَدْ اَرْسَلْنَا مِنْ قَبْلِكَ فِي شِيَعِ الْاَوَّلِينَ ﴿١٠﴾
وَمَا يَأْتِيهِمْ مِنْ رَسُولٍ اِلَّا كَانُوا بِهٖ يَسْتَهْزِؤُنَ ﴿١١﴾

---

*(*Qeyd: Cahil və inadkar insan nə pis olur. Elm və hikmət ilə dolu olub haqqı tanımağı, maarifi, iffət və isməti əmr edən şəxsə dəli adı verirlər. Bütpərəstliyi ağıllılıq sayıb, yeganə olan Allah-Təalaya sitayiş etməyi cahil əməli adlandıran şəxslərə necə hidayət edib doğru yola qovuşdurmaq olar? Cahil və nadanlarla birlikdə yaşamaq və onların sözlərinə qulaq asmaq insanı cəhənnəm odunda yanmağa düçar edər. (Ey baba, ey peyğəmbər, cahillərin sözlərindən və əməllərindən nə bəlalara, nə möhnətlərə düçar oldun. Necə zəhmətlər çəkib, islam dinini yayıb, onun əsasını möhkəmləndirdin. Bizim bu zamanımız cahiliyyə dövrünə oxşayıb islamın adından və surətindən başqa bir şey qalmayıbdır. Onun kökü cəhalət baltasıyla yaralanıb, zalımların pəncəsi ilə xarab olub, ayaqlar altında qalıbdır. İlahi, müsəlmanları birləşdirəcək bir islam kəlməsi göndər ki, xəbis cəhalət toxumu müsəlmanların arasından dəf olub elm və mərifət nuru yayılsın. Amin!)*

**7)** (لَوْ مَا تَأْتِينَا بِالْمَلٰٓئِكَةِ اِنْ كُنْتَ مِنَ الصَّادِقِينَ) **-** (müşriklər deyir:) **əgər doğru deyənsənsə, nədən ötrü bizə mələklər gətirmirsən** (ki, sənə kömək olub sənin doğru olduğuna şəhadət etsinlər)**.**

**8)** (مَا نُنَزِّلُ الْمَلٰٓئِكَةَ اِلَّا بِالْحَقِّ) **-** (ey Məhəmməd, səndən mələkləri istəyirlər), **mələkləri ancaq hikmət və məsləhət üzrə** (vəhy, ya da əzabdan ötrü) **göndərərik,** (وَمَا كَانُوٓا اِذًا مُنْظَرِينَ) – (əgər bu müşriklərə mələklər göndərsək, əzabdan ötrü göndərərik)**. O vaxt da** (onların əzabı təxirə salınmayıb)**, onlara möhlət verilməz,** (əzab onları yaxalayıb həlak olarlar)**.**

**9)** (اِنَّا نَحْنُ نَزَّلْنَا الذِّكْرَ) **-** (ey Məhəmməd, bu müşriklər sənə istehza edib deyirlər ki, dəlisən, Quran da Allah-Təaladan deyil, onların cavabında dedik:) **həqiqətən, əlbəttə, Quranı biz nazil edib** (sənə göndərmişik). (وَاِنَّا لَهُ لَحَافِظُونَ) **- həqiqətən, biz özümüz o Quranı** (hər bir dəyişiklikdən, artıb-əskilmədən) **qoruyub saxlayarıq.** (Heç kim Quranı dəyişdirə bilməz. Necə ki bu zamana kimi Qurani-Şərif islam şəriətinin sahibi Hz. Peyğəmbərin qoyub getdiyi şəkildə qalıb, bir hərfini, ya da bir nöqtəsini dəyişdirməyə heç kimdə güc yoxdur. Allah-Təaladan nazil olan, Hz. Peyğəmbərin bizə tapşırdığı Quran həmin əlimizdəki Qurandır. Quranın artıq-əskik olmasına inanmaq batildir)**.**

**10)** (وَلَقَدْ اَرْسَلْنَا مِنْ قَبْلِكَ فِي شِيَعِ الْاَوَّلِينَ) **-** (ey Məhəmməd, bu Məkkə əhlinin sənə dəli deyib istehza etməsinə üzülmə)**, həqiqətən, səndən əvvəlki ümmətlərə də** (peyğəmbər) **göndərdik.**

**11)** (وَمَا يَأْتِيهِمْ مِنْ رَسُولٍ اِلَّا كَانُوا بِهٖ يَسْتَهْزِؤُنَ) – **onlara elə bir peyğəmbər gəlmədi ki, ona istehza etməsinlər.** (Necə ki Məkkə əhli sənə istehza edir, bu müşriklərin sənə istehza etmələrinə səbir et. Necə ki səndən əvvəlki peyğəmbərlər də səbir edib)**.**

كَذٰلِكَ نَسْلُكُهُ فِي قُلُوبِ الْمُجْرِمِينَ ﴿١٢﴾ لَا يُؤْمِنُونَ بِهِ وَقَدْ خَلَتْ سُنَّةُ الْاَوَّلِينَ ﴿١٣﴾ وَلَوْ
فَتَحْنَا عَلَيْهِمْ بَابًا مِنَ السَّمَاءِ فَظَلُّوا فِيهِ يَعْرُجُونَ ﴿١٤﴾ لَقَالُوا اِنَّمَا سُكِّرَتْ اَبْصَارُنَا بَلْ نَحْنُ قَوْمٌ
مَسْحُورُونَ ﴿١٥﴾ وَلَقَدْ جَعَلْنَا فِي السَّمَاءِ بُرُوجًا وَزَيَّنَّاهَا لِلنَّاظِرِينَ ﴿١٦﴾ وَحَفِظْنَاهَا مِنْ كُلِّ
شَيْطَانٍ رَجِيمٍ ﴿١٧﴾ اِلَّا مَنِ اسْتَرَقَ السَّمْعَ فَاَتْبَعَهُ شِهَابٌ مُبِينٌ ﴿١٨﴾

---

**12)** (كَذٰلِكَ نَسْلُكُهُ فِي قُلُوبِ الْمُجْرِمِينَ) - (ey Məhəmməd, bu Məkkə əhli Quranı qəbul etməyib sənə istehza edir)**, biz də onu** (Quranı) **günahkar şəxslərin qəlblərinə daxil edərik** (ki, mənasını dərk edib, onlar üçün dəlil-sübut olsun)**.**

**13)** (لَا يُؤْمِنُونَ بِهِ) – (bununla belə Qurana) **iman gətirməzlər,** (وَقَدْ خَلَتْ سُنَّةُ الْاَوَّلِينَ) **- halbuki özlərindən əvvəlki ümmətlərin başına gələnlər** (gözlərinin qabağında) **gəlib-keçibdir.** (Peyğəmbərlərə iman etməyənlərə əzab nazil edib, həlak olublar. Bu Məkkə əhli keçmiş ümmətlərin əhvalatına baxıb ibrət almayıb, qorxmurlar ki, onlara da əzab nazil olar. Necə ki keçmiş ümmətlərə nazil oldu)**.**

**14)** (وَلَوْ فَتَحْنَا عَلَيْهِمْ بَابًا مِنَ السَّمَاءِ فَظَلُّوا فِيهِ يَعْرُجُونَ) **-** (ey Məhəmməd)**, əgər** (müşriklərdən ötrü) **səmadan bir qapı açsaq, gündüz vaxtı o qapıdan çıxıb** (səmaya) **dırmaşsalar,**

**15)** (لَقَالُوا اِنَّمَا سُكِّرَتْ اَبْصَارُنَا) **- əlbəttə, deyəcəklər ki, həqiqətən, bizim gözlərimiz** (məst olan şəxsin gözləri kimi) **çaşbaş olub,** (bu həqiqəti olmayan xəyali bir şeydir)**.** (بَلْ نَحْنُ قَوْمٌ مَسْحُورُونَ) **- yox, bəlkə, biz** (Məhəmməd tərəfindən) **sehrlənmiş bir qövm və camaatıq,** (bizcə bu sehrdəndir. Bəs bu müşriklər imana gələn deyildir. Səbir edib onları bizə həvalə et)**.**

**16)** (وَلَقَدْ جَعَلْنَا فِي السَّمَاءِ بُرُوجًا وَزَيَّنَّاهَا لِلنَّاظِرِينَ)**- həqiqətən, biz səmada** (12)* **bürc yaratdıq və** (səmaya ibrət gözüylə) **baxanlardan ötrü onu** (parlaq ulduzlarla) **zinətləndirdik.** (Səmaya ibrət gözüylə baxanlar tövhidə inanıb başqa dəlil istəməzlər)**.**

**17)** (وَحَفِظْنَاهَا مِنْ كُلِّ شَيْطَانٍ رَجِيمٍ) **– və** (səmanı Allah-Təalanın dərgahından) **qovulan** (daşqalaq edilən) **hər bir şeytandan mühafizə edib qoruyarıq.**

**18)** (اِلَّا مَنِ اسْتَرَقَ السَّمْعَ فَاَتْبَعَهُ شِهَابٌ مُبِينٌ) – (şeytanlardan heç biri səmaya yol tapmaz)**, ancaq gizlin** (söz oğurlamaqdan ötrü) **qulaq asarlar. O vaxt da** (Allah-Təala tərəfindən bir parça) **od gəlib** (onları dəf edər)**.** (Səma hidayətinin günəşi Məhəmməd ibn Abdullahı (ə.s), hər bir şər və həsədçi şəxslərdən mühafizə etdik. Açıq-aşkar ona qalib gələ bilmədilər. Ancaq gizlində məkr və hiylə edib hicrət gecəsi ona zərər vermək istədilər, o nurlu günəşin yatağında yatıb özünü ona fəda edib atəş qığılcımı kimi yandıran Əli ibn Əbu Talibin sayəsində onların şərini o cənabdan dəf etdik)**.**

وَالْاَرْضَ مَدَدْنَاهَا وَاَلْقَيْنَا فِيهَا رَوَاسِيَ وَاَنْبَتْنَا فِيهَا مِنْ كُلِّ شَيْءٍ مَوْزُونٍ ﴿١٩﴾ وَجَعَلْنَا لَكُمْ فِيهَا
مَعَايِشَ وَمَنْ لَسْتُمْ لَهُ بِرَازِقِينَ ﴿٢٠﴾ وَاِنْ مِنْ شَيْءٍ اِلَّا عِنْدَنَا خَزَآئِنُهُ وَمَا نُنَزِّلُهُ اِلَّا بِقَدَرٍ مَعْلُومٍ
﴿٢١﴾ وَاَرْسَلْنَا الرِّيَاحَ لَوَاقِحَ فَاَنْزَلْنَا مِنَ السَّمَآءِ مَآءً فَاَسْقَيْنَاكُمُوهُ وَمَآ اَنْتُمْ لَهُ بِخَازِنِينَ ﴿٢٢﴾
وَاِنَّا لَنَحْنُ نُحْيِي وَنُمِيتُ وَنَحْنُ الْوَارِثُونَ ﴿٢٣﴾ وَلَقَدْ عَلِمْنَا الْمُسْتَقْدِمِينَ مِنْكُمْ وَلَقَدْ عَلِمْنَا
الْمُسْتَأْخِرِينَ ﴿٢٤﴾

---

*(*Qeyd: 12 bürcün adları bunlardır: 1-həməl (qoç), 2-sevr (boğa), 3-cövza (əkizlər), 4-sərətan (xərçəng), 5-əsəd (aslan), 6-sünbülə (başaq, qız), 7-mizan (tərəzi), 8-əqrəb, 9-qövs (yay, oxatan), 10-cədi (oğlaq), 11-dəlv (dolça), 12-hut (balıq). Bu 12 bürc 12 şəmsi (günəş) aylardır. Bir şəmsi ilimiz bu 12 şəmsi aylardan ibarətdir).*

**19)** (وَالْاَرْضَ مَدَدْنَاهَا) **- yeri** (siz insanlardan ötrü) **açıb döşədik ki,** (asan şəkildə məişətinizi təmin edəsiniz)**.** (وَاَلْقَيْنَا فِيهَا رَوَاسِيَ) **– və orada sabit və möhkəm dağlar yerləşdirdik** (ki, o dağların səbəbinə mənfəət əldə edəsiniz)**.** (وَاَنْبَتْنَا فِيهَا مِنْ كُلِّ شَيْءٍ مَوْزُونٍ) – (Allah-Təalanın hikməti və məxluqatın faydasına görə) **hər bir şeydən müəyyən ölçüdə** (yerdə) **göyərtdik.**

**20)** (وَجَعَلْنَا لَكُمْ فِيهَا مَعَايِشَ) **- sizdən ötrü** (yer üzündə) **yaşayışa lazım olan** (yemək, içmək və geymək üçün) **şeylər yaratdıq.** (وَمَنْ لَسْتُمْ لَهُ بِرَازِقِينَ) – (sizdən ötrü ailə və yerdə heyvanlardan yaratdıq)**, hansı ki siz onlara ruzi verən deyilsiniz.** (Allah-Təala onlara ruzi verir. Amma siz onların sahibisiniz)**.**

**21)** (وَاِنْ مِنْ شَيْءٍ اِلَّا عِنْدَنَا خَزَآئِنُهُ) – (dünyada insanların mənfəət əldə etdiyi) **elə bir şey yoxdur ki, o şeylərin hamısının xəzinəsi bizim yanımızda olmasın** (və biz o şeyləri yaratmağa və insanlara bəxş etməyə qadirik)**.** (وَمَا نُنَزِّلُهُ اِلَّا بِقَدَرٍ مَعْلُومٍ) **– biz ondan** (insanlara) **lazım olan qədər bəxş edərik.** (Allah-Təala hər bir şeyi yaratmağa qadir olduğundan xəzinəni məsəl çəkir)**.**

**22)** (وَاَرْسَلْنَا الرِّيَاحَ لَوَاقِحَ) – (Allah-Təala bu ayələrdə öz qüdrətini bəyan edir. Ey Məhəmməd,) **biz** (buludlar yaradıb, qar və yağış gətirən) **küləklər göndərdik.** (فَاَنْزَلْنَا مِنَ السَّمَاءِ مَاءً فَاَسْقَيْنَاكُمُوهُ) **- səmadan su göndərib** (o su səbəbilə) **sizi suvarırıq.** (وَمَا اَنْتُمْ لَهُ بِخَازِنِينَ) **- siz onu** (icad edib) **toplamağa qadir deyilsiniz.** (Bəlkə o yağışların xəzinəsi bizim yanımızdadır. Onun icadına ancaq biz qadirik)**.**

**23)** (وَاِنَّا لَنَحْنُ نُحْيِي وَنُمِيتُ) **- əlbəttə,** (xalqı yoxdan yaradıb)**, dirildib,** (dirildəndən sonra) **öldürən bizik.** (وَنَحْنُ الْوَارِثُونَ) – (bütün insanları həlak edəndən sonra qalıb fani olmayan, insanların malik olduqlarına) **varis olan bizik.**

**24)** (وَلَقَدْ عَلِمْنَا الْمُسْتَقْدِمِينَ مِنْكُمْ وَلَقَدْ عَلِمْنَا الْمُسْتَأْخِرِينَ) – (ey Qurana iman gətirənlər)**, həqiqətən, sizdən əvvəl** (imana daxil olanlara) **və təxirə salıb** (imana

**وَاِنَّ رَبَّكَ هُوَ يَحْشُرُهُمْ ۜ اِنَّهُ حَكِيمٌ عَلِيمٌ ۟ ﴿٢٥﴾ وَلَقَدْ خَلَقْنَا الْاِنْسَانَ مِنْ صَلْصَالٍ مِنْ حَمَاٍ مَسْنُونٍ ۚ**
**﴿٢٦﴾ وَالْجَآنَّ خَلَقْنَاهُ مِنْ قَبْلُ مِنْ نَارِ السَّمُومِ ﴿٢٧﴾ وَاِذْ قَالَ رَبُّكَ لِلْمَلٰئِكَةِ اِنّ۪ي خَالِقٌ بَشَرًا مِنْ**
**صَلْصَالٍ مِنْ حَمَاٍ مَسْنُونٍ ﴿٢٨﴾ فَاِذَا سَوَّيْتُهُ وَنَفَخْتُ ف۪يهِ مِنْ رُوح۪ي فَقَعُوا لَهُ سَاجِد۪ينَ ﴿٢٩﴾**

---

gec daxil olanlardan) **agahıq.** (İmanı təxirə salanlar tez iman gətirənlərə bərabər olmaz)**.**

**25)** (وَاِنَّ رَبَّكَ هُوَ يَحْشُرُهُمْ) **-** (ey Məhəmməd)**, həqiqətən, sənin rəbbin** (qiyamət günündə) **hər kəsi bir yerə toplayıb** (ondan sonra hər bir şəxsin öz əməlinin qarşılığını ona verəcəkdir)**.** (اِنَّهُ حَك۪يمٌ عَل۪يمٌ) **- həqiqətən,** (hər bir şey) **hikmət üzrə** (Allah-Təaladan olub hamısını əhatə edib onlardan) **agahdır.**

**26)** (وَلَقَدْ خَلَقْنَا الْاِنْسَانَ مِنْ صَلْصَالٍ مِنْ حَمَاٍ مَسْنُونٍ) **-** (ey Məhəmməd, bu insan bizə qarşı təkəbbürlənib, ibadət və itaət etməkdən kənar olub bizə şərik qoşur. Bax gör, biz bu insanı nədən yaratmışıq)**, həqiqətən, insanın** (əsl əcdadı olan Adəmi toxununca səs çıxaran) **quru və qoxumuş** (başqa şəklə düşmüş qara) **palçıqdan yaratdıq.**

**27)** (وَالْجَآنَّ خَلَقْنَاهُ مِنْ قَبْلُ مِنْ نَارِ السَّمُومِ) **- cinləri də** (Adəmdən qabaq) **şiddətli oddan yaratdıq.** (Qurani-Şərifin bu ayəsinə və bu kimi başqa ayələrinə görə, cin tayfası da yer üzündə bir məxluq olubdur. Amma bu tayfa hansı tayfadır və yaradılışı, mahiyyəti necə olub, indi dünyada var, yoxsa yoxdur? Dünyada olanda mikroskop kimi, yoxsa maqnit kimi, ya da kəhrəba kimi bir şeydir ki, bizim gözümüz onları dərk etmir? (Necə ki deyiblər), bu ağlın dərk edə bilməyəcəyi bir şeydir. Ya da cindən məqsəd çöl əhli olan bədəvilərdir, təbiətləri qəliz, özləri də qəzəbli olduqlarından onların yaradılış mahiyyətini oda isnad edir. Təfəkkür etmək lazımdır. Ola bilər ki, bu camaat Adəmdən əvvəl yer kürəsinin bir tərəfində yaradılmış olsun və biz ona agah olmayaq. Allahın nə çox məxluqatı var, Onu təsbeh edərik. Növbəti ayədə Allah-Təala xitab edib Hz. Peyğəmbərə buyurur: "Ey Məhəmməd, Adəmin yaradılış əhvalatı gör necə oldu?")

**28)** (وَاِذْ قَالَ رَبُّكَ لِلْمَلٰٓئِكَةِ اِنّ۪ي خَالِقٌ بَشَرًا مِنْ صَلْصَالٍ مِنْ حَمَاٍ مَسْنُونٍ) **-** (ey Məhəmməd, yadına sal ki,) **rəbbin Allah-Təala mələklərə demişdi: həqiqətən, mən** (toxununca səslənən) **quru və qoxumuş qara palçıqdan bir insan yaradacağam.**

**29)** (فَاِذَا سَوَّيْتُهُ وَنَفَخْتُ ف۪يهِ مِنْ رُوح۪ي) **- mən ona** (Adəmə) **surət verib öz ruhumdan ona üflədiyimdə** (yəni həyat verdiyimdə; ruh üflədim demək, Adəmi yaratmasını simvolik olaraq anlatmaqdan ötrüdür. Yoxsa, həqiqətdə nə üfləyən var, nə də üflənən)**.** (فَقَعُوا لَهُ سَاجِد۪ينَ) **–** (elə ki Adəmə ruh daxil oldu, dedim: ey mələklər, Adəmə) **səcdə edin.**

فَسَجَدَ الْمَلٰٓئِكَةُ كُلُّهُمْ اَجْمَعُونَ ۙ ﴿٣٠﴾ اِلَّٓا اِبْلِيسَ اَبٰىٓ اَنْ يَكُونَ مَعَ السَّاجِدِينَ ﴿٣١﴾ قَالَ يَٓا
اِبْلِيسُ مَا لَكَ اَلَّا تَكُونَ مَعَ السَّاجِدِينَ ﴿٣٢﴾ قَالَ لَمْ اَكُنْ لِاَسْجُدَ لِبَشَرٍ خَلَقْتَهُ مِنْ صَلْصَالٍ مِنْ
حَمَاٍ مَسْنُونٍ ﴿٣٣﴾ قَالَ فَاخْرُجْ مِنْهَا فَاِنَّكَ رَجِيمٌ ﴿٣٤﴾ وَاِنَّ عَلَيْكَ اللَّعْنَةَ اِلٰى يَوْمِ الدِّينِ ﴿٣٥﴾
قَالَ رَبِّ فَاَنْظِرْنٖٓي اِلٰى يَوْمِ يُبْعَثُونَ ﴿٣٦﴾ قَالَ فَاِنَّكَ مِنَ الْمُنْظَرِينَ ۙ ﴿٣٧﴾ اِلٰى يَوْمِ الْوَقْتِ الْمَعْلُومِ
﴿٣٨﴾ قَالَ رَبِّ بِمَٓا اَغْوَيْتَنٖي لَاُزَيِّنَنَّ لَهُمْ فِي الْاَرْضِ وَلَاُغْوِيَنَّهُمْ اَجْمَعٖينَ ۙ ﴿٣٩﴾

---

**30)** (فَسَجَدَ الْمَلٰٓئِكَةُ كُلُّهُمْ اَجْمَعُونَ) – (bizim əmrimizə görə) **bütün mələklər tamamən Adəmə səcdə etdilər.**

**31)** (اِلَّٓا اِبْلِيسَ اَبٰىٓ اَنْ يَكُونَ مَعَ السَّاجِدِينَ) – **ancaq iblis** (şeytan) **səcdə edən** (mələklərlə) **birlikdə olmaqdan imtina edib** (Adəmə) **səcdə etmədi.**

**32)** (قَالَ يَٓا اِبْلِيسُ مَا لَكَ اَلَّا تَكُونَ مَعَ السَّاجِدِينَ) – (Allah-Təala) **dedi: "Ey iblis, nə oldu ki,** (Adəmə) **səcdə edən** (mələklərlə) **bir olmayıb** (Adəmə səcdə etmədin?)"

**33)** (قَالَ لَمْ اَكُنْ لِاَسْجُدَ لِبَشَرٍ خَلَقْتَهُ مِنْ صَلْصَالٍ مِنْ حَمَاٍ مَسْنُونٍ) - **iblis dedi: "Mən** (toxununca səslənən) **quru və qoxumuş qara palçıqdan yaratdığın insana səcdə etmərəm."**

**34)** (قَالَ فَاخْرُجْ مِنْهَا فَاِنَّكَ رَجِيمٌ) – (Allah-Təala) **dedi:** (bir halda ki, Adəmə səcdə etmədin, ilahi rəhmət və lütfdən kənar olub)**, çıx. Həqiqətən, sən Allah-Təalanın rəhmətindən** (rədd edilib) **qovuldun.**

**35)** (وَاِنَّ عَلَيْكَ اللَّعْنَةَ اِلٰى يَوْمِ الدِّينِ) – (ey iblis, Allah-Təalanın rəhmətindən uzaq olmaq) **lənəti qiyamət gününə kimi sənin üzərinə olsun.** (Ondan sonra sənə elə bir əzab olunsun ki, lənəti yadından çıxartsın)**.**

**36)** (قَالَ رَبِّ فَاَنْظِرْنٖي اِلٰى يَوْمِ يُبْعَثُونَ) - **iblis dedi: "Ey mənim rəbbim, qiyamət gününə kimi mənə möhlət verib** (məni həlak etmə." Yəni qiyamət gününə kimi diri qalım, qiyamətdə də ölmək yoxdur, heç vaxt ölməyim. İblis əbədi bir həyat istəyir, Allah-Təala onun cavabında gələn ayəni buyurur)**.**

**37-38)** (قَالَ فَاِنَّكَ مِنَ الْمُنْظَرِينَ اِلٰى يَوْمِ الْوَقْتِ الْمَعْلُومِ) – (Allah-Təala) **dedi:** (ey iblis)**, həqiqətən,** (yanımızda) **məlum olan vaxta kimi sən möhlət verilənlərdən oldun,** (ta o vaxta kimi ki, qiyamətdən qabaq bütün insanlar həlak olduqda o vaxt sən də həlak olarsan. Amma qiyamətə kimi sənə vaxt verilib ki, həmişə diri qalasan, əbədi diri qalman mümkün deyil)**.**

**39)** (قَالَ رَبِّ بِمَٓا اَغْوَيْتَنٖي لَاُزَيِّنَنَّ لَهُمْ فِي الْاَرْضِ) – (iblis) **dedi: "Ey mənim rəbbim,** (mənə Adəmə səcdə etməyi əmr edib, mən də səcdə etmədim, beləliklə) **sən də məni** (asi edib)**, zəlalətə saldın. Mən də dünyada** (Adəm övladına günahkar olub sənə asi olmağı) **zinətləndirəcəyəm.** (وَلَاُغْوِيَنَّهُمْ اَجْمَعٖينَ) **- əlbəttə, on-**

اِلَّا عِبَادَكَ مِنْهُمُ الْمُخْلَصِينَ ﴿٤٠﴾ قَالَ هٰذَا صِرَاطٌ عَلَيَّ مُسْتَقِيمٌ ﴿٤١﴾ اِنَّ عِبَادِي لَيْسَ لَكَ
عَلَيْهِمْ سُلْطَانٌ اِلَّا مَنِ اتَّبَعَكَ مِنَ الْغَاوِينَ ﴿٤٢﴾ وَاِنَّ جَهَنَّمَ لَمَوْعِدُهُمْ اَجْمَعِينَ ﴿٤٣﴾ لَهَا سَبْعَةُ
اَبْوَابٍ لِكُلِّ بَابٍ مِنْهُمْ جُزْءٌ مَقْسُومٌ ﴿٤٤﴾ اِنَّ الْمُتَّقِينَ فِي جَنَّاتٍ وَعُيُونٍ ﴿٤٥﴾ اُدْخُلُوهَا بِسَلَامٍ
اٰمِنِينَ ﴿٤٦﴾ وَنَزَعْنَا مَا فِي صُدُورِهِمْ مِنْ غِلٍّ اِخْوَانًا عَلٰى سُرُرٍ مُتَقَابِلِينَ ﴿٤٧﴾

---

**ların hamısını** (asi edib) **zəlalətə salacağam.** (Ta ki kafir olub mənim kimi əzaba düçar olsunlar)**.**

**40)** (اِلَّا عِبَادَكَ مِنْهُمُ الْمُخْلَصِينَ) – (hamısını asi edərəm)**, ancaq səndən ötrü iman və tövhidlərini ixlaslı edən bəndələrin istisna,** (onları zəlalətə salmağa mənim taqətim olmaz)**.**

**41)** (قَالَ هٰذَا صِرَاطٌ عَلَيَّ مُسْتَقِيمٌ) – (Allah-Təala) **dedi:** (ey iblis)**, məndən ötrü düz olan yol** (imanı ixlaslı etmək yolu) **budur,** (və mənə haqq lazımdır. Bu yolu qoruyaram ki, mənim ixlaslı bəndələrimə hakim olmayasan)**.**

**42)** (اِنَّ عِبَادِي لَيْسَ لَكَ عَلَيْهِمْ سُلْطَانٌ) **- həqiqətən, mənim** (ixlaslı) **bəndələrimə sənin heç bir hakimiyyətin yoxdur,** (onları asi edib haqdan kənar sala bilməzsən)**.** (اِلَّا مَنِ اتَّبَعَكَ مِنَ الْغَاوِينَ) **- ancaq** (asi olub) **sənə tabe olanlar istisnadır,** (onları zəlalətə sala bilərsən. Nəinki mənə iman gətirib sadiq olan bəndələrimi)**.**

**43)** (وَاِنَّ جَهَنَّمَ لَمَوْعِدُهُمْ اَجْمَعِينَ) **-** (ey iblis)**, həqiqətən, cəhənnəm** (sənə və sənə tabe olan) **hər kəsə vəd edilən yerdir.** (Hamınız orada qalacaqsınız)**.**

**44)** (لَهَا سَبْعَةُ اَبْوَابٍ) **- cəhənnəmin 7* qapısı vardır.** (لِكُلِّ بَابٍ مِنْهُمْ جُزْءٌ مَقْسُومٌ) **- hər bir qapıdan ötrü** (cəhənnəmə daxil olanlara) **qismət olunmuş bir hissə vardır.** (O qapıdan daxil olub həmin alt qatda sakin olacaqlar. Allah-Təala onların məqamını bəyan edib ondan sonra gələn ayədə müttəqilərin dərəcəsini bəyan etməyə başlayır)**.**

**45)** (اِنَّ الْمُتَّقِينَ فِي جَنَّاتٍ وَعُيُونٍ) **- həqiqətən, müttəqilərin** (mənzilləri) **gözəl bağlarda və** (axan) **çeşmələrin yanındadır.**

**46)** (اُدْخُلُوهَا بِسَلَامٍ اٰمِنِينَ) – (Allah-Təala tərəfindən) **müttəqilərə deyilər:** (bu bağlara salamat və hər bir qorxudan) **əmin olduğunuz halda daxil olun.**

**47)** (وَنَزَعْنَا مَا فِي صُدُورِهِمْ مِنْ غِلٍّ) – (dünyada) **əgər onların qəlblərində bir kin və ədavət olmuş olsa da,** (axirətdə) **onların qəlblərindən qoparıb çıxarıq.** (اِخْوَانًا عَلٰى سُرُرٍ مُتَقَابِلِينَ) **– bir-biriləri ilə qardaş olduqları halda** (məhəbbət və dostluqla rəftar edib) **qarşı-qarşıya taxtların üstündə** (əyləşərlər)**.**

*(*Qeyd: Allah-Təala Adəmi yaradıb onun ruhuna əmanət qoyulan bacarıqlar (ruhani güclər) ağıla itaət etməklə əmr olundular. Hamısı itaət edib səcdə etdilər. Ancaq xəbis nəfsi-əmmarə öz xəbisliyini izhar edib inadkarlıqla ağla itaət etməkdən*

لَا يَمَسُّهُمْ فِيهَا نَصَبٌ وَمَا هُمْ مِنْهَا بِمُخْرَجِينَ ﴿٤٨﴾ نَبِّئْ عِبَادٖي اَنّٖي اَنَا الْغَفُورُ الرَّحٖيمُ ﴿٤٩﴾
وَاَنَّ عَذَابٖي هُوَ الْعَذَابُ الْاَلٖيمُ ﴿٥٠﴾ وَنَبِّئْهُمْ عَنْ ضَيْفِ اِبْرٰهٖيمَ ﴿٥١﴾ اِذْ دَخَلُوا عَلَيْهِ فَقَالُوا
سَلَامًا قَالَ اِنَّا مِنْكُمْ وَجِلُونَ ﴿٥٢﴾ قَالُوا لَا تَوْجَلْ اِنَّا نُبَشِّرُكَ بِغُلَامٍ عَلٖيمٍ ﴿٥٣﴾ قَالَ اَبَشَّرْتُمُونٖي
عَلٰى اَنْ مَسَّنِيَ الْكِبَرُ فَبِمَ تُبَشِّرُونَ ﴿٥٤﴾ قَالُوا بَشَّرْنَاكَ بِالْحَقِّ فَلَا تَكُنْ مِنَ الْقَانِطٖينَ ﴿٥٥﴾

---

*imtina edib səcdə etmədi və bu səbəbdən Allah-Təalanın dərgahından qovuldu. İblis – xəbis nəfsi-əmmarə insanın 7 orqanını (1-qəlb, 2-göz, 3-qulaq, 4-dil, 5-burun, 6-əl, 7-ayaq) özünə meyil etdirib xidmət etdirdiyindən cəhənnəmin 7 qapısını insanın üzünə açdı. Təfəkkür etmək lazımdır).*

**48)** (لَا يَمَسُّهُمْ فِيهَا نَصَبٌ وَمَا هُمْ مِنْهَا بِمُخْرَجِينَ) – (cənnət əhlinə cənnətdə) **heç bir əziyyət və zəhmət** (yorğunluq) **üz verməyib,** (cənnətdən) **çıxmayıb** (həmişə orada olacaqlar)**.**

**49)** ( نَبِّئْ عِبَادٖيٓ اَنّٖيٓ اَنَا الْغَفُورُ الرَّحٖيمُ) - (ey Məhəmməd)**,** (mənim bəndələrimə) **xəbər verib de ki, həqiqətən,** (günahlarından tövbə edənləri) **bağışlayıb rəhm edən** (Allah-Təala) **mənəm.**

**50)** (وَاَنَّ عَذَابٖي هُوَ الْعَذَابُ الْاَلٖيمُ) **- və həqiqətən,** (günahkar və asi olanlara) **əzabım şiddətli əzabdır.**

**51)** (وَنَبِّئْهُمْ عَنْ ضَيْفِ اِبْرٰهٖيمَ) - (ey Məhəmməd, bəndələrimə) **İbrahimin qonaqlarının** (əhvalatından) **xəbər ver.**

**52)** (اِذْ دَخَلُوا عَلَيْهِ فَقَالُوا سَلَامًا) – (qonaqlar İbrahimin yanına) **daxil olub salam verdikdə,** (قَالَ اِنَّا مِنْكُمْ وَجِلُونَ) – **(İbrahim) dedi: "Həqiqətən, mən sizdən qorxuram."** (Hz. İbrahim onlara yemək gətirdi, onların yemək yeməməsindən qorxuya düşdü)**.**

**53)** (قَالُوا لَا تَوْجَلْ اِنَّا نُبَشِّرُكَ بِغُلَامٍ عَلٖيمٍ) – (mələklər) **dedilər: "**(biz Allah-Təala tərəfindən gələn elçilərik)**, qorxma, həqiqətən, biz sənə** (şəriət ehkamına və ilahi hikmətə) **agah olan bir oğlu** (yəni İshaqı) **müjdə veririk."**

**54)** (قَالَ اَبَشَّرْتُمُونٖي عَلٰى اَنْ مَسَّنِيَ الْكِبَرُ) – (İbrahim) **dedi: "Bəs qocalıq məni yaxalamışkən, mənə oğul müjdəsi verirsiniz?** (Bu, təəccüblü bir işdir)**.** (فَبِمَ تُبَشِّرُونَ) **– məni nə** (təəccüblü) **şeylə müjdələyirsiniz?** (Bəs 90 yaşında kişinin oğlu ola bilərmi?)"

**55)** (قَالُوا بَشَّرْنَاكَ بِالْحَقِّ فَلَا تَكُنْ مِنَ الْقَانِطٖينَ) **- dedilər: "Səni haqq və doğru olan şeylə müjdələdik.** (Ey İbrahim, Allah-Təalanın xeyrindən) **ümidsiz,** (məyus olanlardan) **olma."**

قَالَ وَمَنْ يَقْنَطُ مِنْ رَحْمَةِ رَبِّهٖٓ اِلَّا الضَّٓالُّونَ ﴿٥٦﴾ قَالَ فَمَا خَطْبُكُمْ اَيُّهَا الْمُرْسَلُونَ ﴿٥٧﴾ قَالُوٓا اِنَّٓا
اُرْسِلْنَٓا اِلٰى قَوْمٍ مُجْرِمِينَۙ ﴿٥٨﴾ اِلَّٓا اٰلَ لُوطٍۜ اِنَّا لَمُنَجُّوهُمْ اَجْمَعِينَۙ ﴿٥٩﴾ اِلَّا امْرَاَتَهُ قَدَّرْنَٓاۙ اِنَّهَا
لَمِنَ الْغَابِرِينَ۟ ﴿٦٠﴾ فَلَمَّا جَٓاءَ اٰلَ لُوطٍ الْمُرْسَلُونَۙ ﴿٦١﴾ قَالَ اِنَّكُمْ قَوْمٌ مُنْكَرُونَ ﴿٦٢﴾ قَالُوا
بَلْ جِئْنَاكَ بِمَا كَانُوا فِيهِ يَمْتَرُونَ ﴿٦٣﴾ وَاَتَيْنَاكَ بِالْحَقِّ وَاِنَّا لَصَادِقُونَ ﴿٦٤﴾

---

**56)** (قَالَ وَمَنْ يَقْنَطُ مِنْ رَحْمَةِ رَبِّهٖٓ اِلَّا الضَّٓالُّونَ) – (İbrahim) **dedi: “Kimdir Allah-Təalanın rəhmətindən ümidsiz olan?** (Asi olub Haqq yolundan) **azanlardan başqası** (Allah-Təalanın rəhmətindən ümidsiz olmaz”, yəni mən Allah-Təalanın rəhmətindən ümidsiz olub övlad sahibi olmağı inkar etmirəm, lakin adət üzrə qoca kişinin və qoca qadının övladı olmadığından bu sözləri deyirəm)**.**

**57)** (قَالَ فَمَا خَطْبُكُمْ اَيُّهَا الْمُرْسَلُونَ) –(İbrahim) **dedi:** (ey mələklər, mənə övlad müjdəsi verməkdən başqa) **işiniz nədir?**

**58)** (قَالُوا اِنَّٓا اُرْسِلْنَٓا اِلٰى قَوْمٍ مُجْرِمِينَ) **- dedilər: biz** (Allah-Təala tərəfindən) **asi və günahkar olan qövmü** (Lut qövmünü həlak etməkdən ötrü) **göndərilmişik.**

**59)** (اِلَّٓا اٰلَ لُوطٍ اِنَّا لَمُنَجُّوهُمْ اَجْمَعِينَ) – (Lutun qövmü həlak olacaqdır)**, ancaq Lutun ailəsinə, həqiqətən, nicat verəcəyik.**

**60)** (اِلَّا امْرَاَتَهُ قَدَّرْنَٓا اِنَّهَا لَمِنَ الْغَابِرِينَ) **- ancaq** (Lutun) **arvadı** (istisnadır)**,** (Allah-Təalanın əmriylə) **hökm etmişik ki, həqiqətən,** (Lutun arvadı əzab içində) **qalanlardan olub** (həlak olacaq)**.**

**61)** (فَلَمَّا جَٓاءَ اٰلَ لُوطٍ الْمُرْسَلُونَ) **-** (mələklər Hz. İbrahimin yanından çıxıb yaraşıqlı cavanlar kimi) **Lutun ailəsinin yanına daxil oldular,**

**62)** (قَالَ اِنَّكُمْ قَوْمٌ مُنْكَرُونَ) – (qövmünün kişiləri kişilərə qarşı şəhvani meyilli olduğundan Lut onları gördükdə) **dedi: “Həqiqətən, siz inkar edib** (nifrət etdiyim bir camaatsınız)”**,**

**63)** (قَالُوا بَلْ جِئْنَاكَ بِمَا كَانُوا فِيهِ يَمْتَرُونَ) – (mələklər) **dedilər:** (bizə nifrət etmə)**, bəlkə biz onların** (gəlməsinə) **şəkk-şübhə etdiyi əzabdan ötrü gəlmişik,** (hansı ki Allah-Təala tərəfindən olan əmrlə sən onu qövmünə vəd edib deyirdin: “Bu şəhvani əməlinizdən ötrü Allah-Təala sizə əzab göndərər”, onlar isə səni təkzib edirdilər)**.**

**64)** (وَاَتَيْنَاكَ بِالْحَقِّ وَاِنَّا لَصَادِقُونَ) **-** (ey Lut)**, biz sənə haqq və yəqin üzrə** (onlara əzab nazil olacağından ötrü) **gəlmişik.** (Budur həqiqət, biz bu əzab xəbərini sənə verməkdə) **əlbəttə, doğru deyənik.**

فَاَسْرِ بِاَهْلِكَ بِقِطْعٍ مِنَ الَّيْلِ وَاتَّبِعْ اَدْبَارَهُمْ وَلَا يَلْتَفِتْ مِنْكُمْ اَحَدٌ وَامْضُوا حَيْثُ تُؤْمَرُونَ ﴿٦٥﴾
وَقَضَيْنَٓا اِلَيْهِ ذٰلِكَ الْاَمْرَ اَنَّ دَابِرَ هٰؤُلَٓاءِ مَقْطُوعٌ مُصْبِحِينَ ﴿٦٦﴾ وَجَٓاءَ اَهْلُ الْمَدِينَةِ يَسْتَبْشِرُونَ ﴿٦٧﴾
قَالَ اِنَّ هٰؤُلَٓاءِ ضَيْفِي فَلَا تَفْضَحُونِ ﴿٦٨﴾ وَاتَّقُوا اللّٰهَ وَلَا تُخْزُونِ ﴿٦٩﴾ قَالُوٓا اَوَلَمْ نَنْهَكَ عَنِ
الْعَالَمِينَ ﴿٧٠﴾

---

**65)** (فَاَسْرِ بِاَهْلِكَ بِقِطْعٍ مِنَ الَّيْلِ) – (ey Lut)**, gecənin axırında öz ailəni götürüb** (qəsəbədən çıxıb) **yola düş,** (وَاتَّبِعْ اَدْبَارَهُمْ) – (ailəni qabağa salıb)* **sən də onların dalınca düş.** (وَلَا يَلْتَفِتْ مِنْكُمْ اَحَدٌ) **- sizdən heç kim arxasına dönüb baxmasın.** (وَامْضُوا حَيْثُ تُؤْمَرُونَ) **- əmr olunduğunuz yerə** (Şama) **gedin.**

*(*__Qeyd:__ Sual: Səbəb nədir ki, Allah-Təala Luta – ailəni qabağa salıb özün onların arxasınca get, heç kim də arxasına dönüb baxmasın - deyə əmr edir? Cavab: Allah-Təala Lutun duasını qəbul edib, qövmünə əzab göndərib özünə və ailəsinə nicat verdikdə, qəsəbədən çıxmalarını əmr etdi. Ailəsinin qabaqda, özünün onların arxasınca getməsinin səbəbi odur ki, əgər Lut özü qabaqda, ailəsi onun arxasınca getsəydi, bu halətdə Lutun fikri onlarda olub qəlbi sakit olmazdı. Necə ki qorxub qaçan bir şəxs ailəsini qabağa salıb sürətlə gedər. Lutun qəlbi ailəsinə görə rahat olduğuna görə, onların dalınca getməyi əmr edildi və arxaya baxmamaqla əmr olunmalarının səbəbi odur ki, arxaya baxdıqlarında qövmə nazil olan əzabı görüb qəlbləri yanardı. Kafir və müşriklərdən ötrü rəhmə gəlib qəlbin yumşalması caiz olmadığına görə, bu şəkildə əmr olundular).*

**66)** (وَقَضَيْنَٓا اِلَيْهِ ذٰلِكَ الْاَمْرَ) **-** (ey Məhəmməd)**, vəhy edib** (Luta dedik ki, sənin qövmün barəsində bizim tərəfimizdən olan) **bu** (əzab) **hökmü qətidir.** (اَنَّ دَابِرَ هٰؤُلَٓاءِ مَقْطُوعٌ مُصْبِحِينَ) – (onların barəsində belə hökm olunubdur:) **Sübh çağı** (onlara əzab gəlib) **hamısı** (həlak olub) **kökləri kəsiləcək.**

**67)** (وَجَٓاءَ اَهْلُ الْمَدِينَةِ يَسْتَبْشِرُونَ) – (Lutun qonaqlarının gözəl cavanlar olduğunu görəndə) **şəhər əhli** (qonaqlar haqqında) **bir-birilərinə müjdə verdikləri halda** (Lutun yanına) **gəldilər.**

**68)** (قَالَ اِنَّ هٰؤُلَٓاءِ ضَيْفِي فَلَا تَفْضَحُونِ) – (Lut) **dedi:** (ey camaat)**, bunlar mənim qonaqlarımdır, məni rüsvay etməyin.**

**69)** (وَاتَّقُوا اللّٰهَ وَلَا تُخْزُونِ) **- Allah-Təaladan qorxub, məni zəlil etməyin.**

**70)** (قَالُوٓا اَوَلَمْ نَنْهَكَ عَنِ الْعَالَمِينَ) **- dedilər:** (ey Lut)**, biz sənə adamların işinə mane olmağı qadağan etmədikmi** (ki, indi bizim şəhvani əməlimizə mane olursan? Lutun qövmü şəhərə girən, ya da ətrafdan keçən şəxsləri tutub onlarla pis işlərlə məşğul olduqlarından Lut bunu onlara qadağan etdi. Onlar Luta etiraz edib deyirdilər: "Sən bizim işimizə mane olma. Biz sənə qulaq asan deyilik")**.**

قَالَ هٰؤُلَاۤءِ بَنَاتٖۤي اِنْ كُنْتُمْ فَاعِلٖينَ ﴿٧١﴾ لَعَمْرُكَ اِنَّهُمْ لَفٖي سَكْرَتِهِمْ يَعْمَهُونَ ﴿٧٢﴾ فَاَخَذَتْهُمُ
الصَّيْحَةُ مُشْرِقٖينَ ﴿٧٣﴾ فَجَعَلْنَا عَالِيَهَا سَافِلَهَا وَاَمْطَرْنَا عَلَيْهِمْ حِجَارَةً مِنْ سِجّٖيلٍ ﴿٧٤﴾ اِنَّ فٖي
ذٰلِكَ لَاٰيَاتٍ لِلْمُتَوَسِّمٖينَ ﴿٧٥﴾ وَاِنَّهَا لَبِسَبٖيلٍ مُقٖيمٍ ﴿٧٦﴾ اِنَّ فٖي ذٰلِكَ لَاٰيَةً لِلْمُؤْمِنٖينَ ﴿٧٧﴾ وَاِنْ
كَانَ اَصْحَابُ الْاَيْكَةِ لَظَالِمٖينَ ﴿٧٨﴾ فَانْتَقَمْنَا مِنْهُمْ

---

**71)** (قَالَ هٰؤُلَاۤءِ بَنَاتٖۤي اِنْ كُنْتُمْ فَاعِلٖينَ) – (Lut) **dedi:** (ey qövm, əgər mənim sözümə qulaq asıb) **nəsə edəcəksinizsə, bu qızlarım** (sizdən ötrü daha yaxşıdır, qonaqlarımın əvəzinə qızlarımı sizə həvalə edərəm. Qonaqlarımın yanında məni xəcil etməyin)**.**

**72)** (لَعَمْرُكَ اِنَّهُمْ لَفٖي سَكْرَتِهِمْ يَعْمَهُونَ) - (ey Məhəmməd)**, and olsun sənin həyatına, həqiqətən,** (Lutun qövmü zəlalət və qəflət) **məstlikləri içində çaşqın və sərgərdan qalıb** (Lutun öyüd-nəsihətinə qulaq asmayıb, zəlalətlərindən çıxmadılar)**.**

**73)** (فَاَخَذَتْهُمُ الصَّيْحَةُ مُشْرِقٖينَ) – **günəş doğarkən o şiddətli səs onları yaxalayıb** (o səsin şiddətindən ciyərləri parçalandı)**.**

**74)** (فَجَعَلْنَا عَالِيَهَا سَافِلَهَا) – (şiddətli zəlzələ ilə) **onların qəsəbələrinin altını üstünə çevirdik.** (وَاَمْطَرْنَا عَلَيْهِمْ حِجَارَةً مِنْ سِجّٖيلٍ) – (onlar həlak olan zaman səmadan yağış yerinə) **üzərlərinə palçıqdan qurumuş daş yağdırdıq.** (Hamısı həlak olub bir şeyləri qalmadı)**.**

**75)** (اِنَّ فٖي ذٰلِكَ لَاٰيَاتٍ لِلْمُتَوَسِّمٖينَ) - **həqiqətən, bu** (Lut qövmünə əzab nazil olmaqda Allah-Təalanın tövhid və qüdrətindən agah olan) **bəsirət sahiblərindən ötrü dəlil və sübutlar vardır.**

**76)** (وَاِنَّهَا لَبِسَبٖيلٍ مُقٖيمٍ) - **və həqiqətən** (Lut qövmünün şəhəri müsafirlərin gəlib-keçdiyi) **yol üstündə durub,** (izləri də qalıbdır. Gedib-gələnlər də onları görürlər. Bəs bu Qüreyş camaatı onları görüb Allah-Təalanın qüdrət və əzəmətinə agah olmazlarmı?)

**77)** (اِنَّ فٖي ذٰلِكَ لَاٰيَةً لِلْمُؤْمِنٖينَ) - **və həqiqətən, bu** (Lut qövmünün şəhərində və qalan izlərində) **möminlərdən ötrü** (Allah-Təalanın tövhid və qüdrətinə dair) **dəlil və sübutlar vardır.** (Möminlərdən başqa onlardan ibrət alan olmaz)**.**

**78)** (وَاِنْ كَانَ اَصْحَابُ الْاَيْكَةِ لَظَالِمٖينَ) - **və həqiqətən, Eykə camaatı** (Şüeyb peyğəmbərin qövmü) **zalımlardan idilər.**

**79)** (فَانْتَقَمْنَا مِنْهُمْ) – (Eykə camaatından) **intiqam alıb,** (onları həlak etdik. Allah-Təala onları 7 gün, 7 gecə isti havaya düçar etsin, az qaldılar ki, istidən həlak olsunlar. Allah-Təala bir bulud göndərdi. Buludun kölgəsinə yığıldılar ki, bəlkə, istidən xilas olsunlar. O buluddan bir od gəlib onları yandırıb həlak

وَاِنَّهُمَا لَبِاِمَامٍ مُبِينٍ ﴿٧٩﴾ وَلَقَدْ كَذَّبَ اَصْحَابُ الْحِجْرِ الْمُرْسَلِينَۙ ﴿٨٠﴾ وَاٰتَيْنَاهُمْ اٰيَاتِنَا فَكَانُوا عَنْهَا مُعْرِضِينَۙ ﴿٨١﴾ وَكَانُوا يَنْحِتُونَ مِنَ الْجِبَالِ بُيُوتًا اٰمِنِينَ ﴿٨٢﴾ فَاَخَذَتْهُمُ الصَّيْحَةُ مُصْبِحِينَۙ ﴿٨٣﴾ فَمَٓا اَغْنٰى عَنْهُمْ مَا كَانُوا يَكْسِبُونَۜ ﴿٨٤﴾ وَمَا خَلَقْنَا السَّمٰوَاتِ وَالْاَرْضَ وَمَا بَيْنَهُمَٓا اِلَّا بِالْحَقِّۜ وَاِنَّ السَّاعَةَ لَاٰتِيَةٌ فَاصْفَحِ الصَّفْحَ الْجَمِيلَ ﴿٨٥﴾

---

etdi). (وَاِنَّهُمَا لَبِاِمَامٍ مُبِينٍ) **- və həqiqətən,** (Lut və Eykə qövmünün şəhərləri) **açıq-aşkar yol üzərindədir.** (Gedib-gələndə onları görürsünüz. Ey Qüreyş camaatı, bəs ibrət almırsınız?)

**80)** (وَلَقَدْ كَذَّبَ اَصْحَابُ الْحِجْرِ الْمُرْسَلِينَ)* **- həqiqətən, Hicr** (Səmud) **camaatı** (onlara göndərilən) **peyğəmbərləri təkzib etdilər.** (O peyğəmbərlərdən biri də Salehdir)**.**

*(*Qeyd: Hicr Şamla Mədinə arasında bir yerin adıdır. İndi bu dövrdə Şamdan Mədinəyə gedəndə onların diyarından keçəndə Səmud camaatının dağlardan yonub düzəltdikləri evlərin zəmanənin gərdişinə dözüb hələ də o şəkildə qaldığı görülür).*

**81)** (وَاٰتَيْنَاهُمْ اٰيَاتِنَا فَكَانُوا عَنْهَا مُعْرِضِينَ) **-** (Səmud camaatına göndərilən peyğəmbərlərə) **möcüzələrimizi verdik.** (O möcüzələrdən biri də Allah-Təala tərəfindən Salehə möcüzəli dəvə verilməsi idi, amma Səmud camaatı) **o möcüzələrdən üz döndərib** (imana daxil olmayıb möcüzələri inkar etdilər)**.**

**82)** (وَكَانُوا يَنْحِتُونَ مِنَ الْجِبَالِ بُيُوتًا اٰمِنِينَ) – (Səmud camaatı öz məskənlərindən ötrü) **arxayın olmaq üçün dağlardan evlər yonub düzəldirdilər.** (Bu səbəbdən özlərini asudə və amanda hesab edib Allah-Təalanın peyğəmbərlərinə iman gətirmədilər)**.**

**83)** (فَاَخَذَتْهُمُ الصَّيْحَةُ مُصْبِحِينَ) **-** (peyğəmbərlərə asi olub Salehə iman etmədiklərindən, Allah-Təala Salehə nicat verib onlara əzab göndərdi)**. Sübh çağı şiddətli səs onları yaxalayıb** (həlak oldular)**.**

**84)** (فَمَٓا اَغْنٰى عَنْهُمْ مَا كَانُوا يَكْسِبُونَ) **-** (Səmud camaatının dünyada) **qazandıqları** (mal və möhkəm daşdan yonulan evləri Allah-Təalanın əzabını onlardan dəf etməyib) **onlara bir fayda vermədi.**

**85)** (وَمَا خَلَقْنَا السَّمٰوَاتِ وَالْاَرْضَ وَمَا بَيْنَهُمَٓا اِلَّا بِالْحَقِّ) (ey Məhəmməd)**, biz səmaları, yeri və onların arasında olan hər bir şeyi ancaq haqq və hikmət üzrə yaratdıq,** (onlara baxanlar fikir verib gərək ibrət alsınlar)**.** (وَاِنَّ السَّاعَةَ لَاٰتِيَةٌ فَاصْفَحِ الصَّفْحَ الْجَمِيلَ) **-** (ey Məhəmməd)**, həqiqətən, qiyamət günü gələcəkdir.** (O zaman da Allah-Təala sənə zülm edən inadkar şəxslərdən intiqam alacaqdır)**. Amma sən onlardan gözəl şəkildə üz döndər,** (onların sənə etdiyi zülm və əziyyətləri* bağışlayıb, intiqam fikrində olmayıb onları Allah-Təalaya həvalə et)**.**

اِنَّ رَبَّكَ هُوَ الْخَلَّاقُ الْعَليمُ ﴿٨٦﴾ وَلَقَدْ اٰتَيْنَاكَ سَبْعًا مِنَ الْمَثَاني وَالْقُرْاٰنَ الْعَظيمَ ﴿٨٧﴾ لَا تَمُدَّنَّ
عَيْنَيْكَ اِلٰى مَا مَتَّعْنَا بِهٖٓ اَزْوَاجًا مِنْهُمْ وَلَا تَحْزَنْ عَلَيْهِمْ وَاخْفِضْ جَنَاحَكَ لِلْمُؤْمِنينَ ﴿٨٨﴾ وَقُلْ
اِنّٖٓي اَنَا النَّذيرُ الْمُبينُۚ ﴿٨٩﴾ كَمَٓا اَنْزَلْنَا عَلَى الْمُقْتَسِمينَۙ ﴿٩٠﴾ اَلَّذينَ جَعَلُوا الْقُرْاٰنَ عِضينَ ﴿٩١﴾

---

*(*Qeyd : İslam ümməti gərək bu ayəyə fikir verib Hz. Peyğəmbərə tabe olub, pislik əvəzinə həmişə yaxşılıq edib, Allah-Təalanın əmr etdiyi gözəl bağışlamaq sifətini gərək özlərinə şüar etsinlər. İslam dininə tənə vuranlar qoy insafla Qurani-Şərifin ayələrinə baxıb Allahın Hz. Peyğəmbərə əmr etdiyi gözəl xüsusiyyətlərə diqqət edib, yer kürəsində olan bütün insanların müsəlman olmalarının vacibliyini və başqa bir dinə ehtiyac olmadığını anlasınlar).*

**86)** (اِنَّ رَبَّكَ هُوَ الْخَلَّاقُ الْعَليمُ) - (ey Məhəmməd)**, həqiqətən,** (səni və bütün məxluqatı) **yaradıb,** (sənin və sair məxluqatın əhvalından və hər bir əməlindən) **agah olub** (hər şəxsin öz əməlinə görə ona qarşılıq verən) **sənin rəbbin Allah-Təaladır.**

**87)** (وَلَقَدْ اٰتَيْنَاكَ سَبْعًا مِنَ الْمَثَاني وَالْقُرْاٰنَ الْعَظيمَ) – (ey Məhəmməd)**, həqiqətən,** (namazda oxunan) **7 ayəni** (Fatihə surəsini) **və əzəmətli Quranı sənə bəxş etdik.** (Heç bir peyğəmbərə onun mislini verməmişik)**.** (Fatihə surəsi hərçənd Qurani-Şərifdən bir surədir, amma Allah-Təalaya həmd-səna etməyi və bəndənin niyaz və qulluq etməsini ehtiva etdiyindən xüsusi olaraq zikr olundu)**.**

**88)** (لَا تَمُدَّنَّ عَيْنَيْكَ اِلٰى مَا مَتَّعْنَا بِهٖٓ اَزْوَاجًا مِنْهُمْ)- (ey Məhəmməd, belə bir Fatihə surəsini və Qurani-Şərifi sənə verəndən sonra) **gözlərini dikib** (kafirlərdən) **bəzilərinə verdiyimiz** (fani dünya malına) **rəğbətlə baxma.** (Sənə elm və hikmət vermişik. Dünya malının Quran yanında nə dəyəri var?) (وَلَا تَحْزَنْ عَلَيْهِمْ) – (kafirlər niyə sənə iman gətirmirlər? – deyə) **məhzun və qəmgin olma.** (وَاخْفِضْ جَنَاحَكَ لِلْمُؤْمِنينَ) **- möminlərə qarşı təvazö edib onlarla gözəl şəkildə rəftar et.** (Möminlər sənə kifayət edər)**.**

**89)** (وَقُلْ اِنّٖٓي اَنَا النَّذيرُ الْمُبينُ) **-** (ey Məhəmməd)**, de ki, həqiqətən, mən** (Allah-Təalanın əzabından sizi dəlil və sübut üzrə) **açıq-aşkar qorxudanam.** (Gəlin Allah-Təalaya iman gətirib əzabdan xilas olun)

**90)** (كَمَٓا اَنْزَلْنَا عَلَى الْمُقْتَسِمينَ) – (ey Qüreyş camaatı, bizim əzabımızdan qorxun)**, necə ki Quranı bölənlərə** (ancaq bir qisminə inanan yəhudilərə əzab) **göndərəcəyik,** (sizə də əzab göndərməyə qadirik)**.**

**91)** (اَلَّذينَ جَعَلُوا الْقُرْاٰنَ عِضينَ) – **o kəslər** (yəhudilər) **ki, Quranı qisimlərə bölüb** (Tövrata müvafiq olana iman gətirirlər, müvafiq olmayana iman gətirməzlər. Bu ayə Məkkədə nazil olub, Allah-Təala bu ayədə Mədinədə olan Bəni-Qüreyzə və Bəni-Nəzir yəhudilərinin Mədinədə Quranın bəzi hökmlərini

فَوَرَبِّكَ لَنَسْـَٔلَنَّهُمْ اَجْمَعٖينَ ﴿٩٢﴾ عَمَّا كَانُوا يَعْمَلُونَ ﴿٩٣﴾ فَاصْدَعْ بِمَا تُؤْمَرُ وَاَعْرِضْ عَنِ الْمُشْرِكٖينَ
﴿٩٤﴾ اِنَّا كَفَيْنَاكَ الْمُسْتَهْزِءٖينَۙ ﴿٩٥﴾ اَلَّذٖينَ يَجْعَلُونَ مَعَ اللّٰهِ اِلٰهًا اٰخَرَۚ فَسَوْفَ يَعْلَمُونَ ﴿٩٦﴾ وَلَقَدْ
نَعْلَمُ اَنَّكَ يَضٖيقُ صَدْرُكَ بِمَا يَقُولُونَۙ ﴿٩٧﴾ فَسَبِّحْ بِحَمْدِ رَبِّكَ وَكُنْ مِنَ السَّاجِدٖينَۙ ﴿٩٨﴾

---

qəbul edib, bəzi digər hökmlərini qəbul etməyəcəyini və onlara əzab nazil olacağını xəbər verir. Allah müsəlmanları onlara hakim edib, bəzisi öldürüldü, bəzisi əsir, digərləri də sürgün edilib vətənlərindən ayrı düşdülər)**.**

**92)** (فَوَرَبِّكَ لَنَسْـَٔلَنَّهُمْ اَجْمَعٖينَ) - (ey Məhəmməd)**, and olsun sənin rəbbin Allah-Təalaya,** (Quranı bölənlərin) **hamısını sorğu-sual edəcəyik.**

**93)** (عَمَّا كَانُوا يَعْمَلُونَ) – **etdikləri əməllərdən** (və Quran haqqında dedikləri sözlərdən) **ötrü.**

**94)** (فَاصْدَعْ بِمَا تُؤْمَرُ وَاَعْرِضْ عَنِ الْمُشْرِكٖينَ) - (ey Məhəmməd, Allah-Təala tərəfindən) **əmr olunduğun şeyləri açıq-aşkar edib** (xalqa çatdırmaq zəhmətinə döz, sənə istehza və məzəmmət edən) **müşriklərdən də üz döndərib,** (onlara fikir vermə)**.**

**95)** (اِنَّا كَفَيْنَاكَ الْمُسْتَهْزِءٖينَ) - **həqiqətən,** (ey Məhəmməd)**, sənə istehza edənləri** (bizə həvalə et)**. Həqiqətən, biz onlara kifayət edərik.**

**96)** (اَلَّذٖينَ يَجْعَلُونَ مَعَ اللّٰهِ اِلٰهًا اٰخَرَ فَسَوْفَ يَعْلَمُونَ) - (sənə* istehza edənlər) **o şəxslərdir ki, özgə məbudları Allah-Təalaya şərik qoşub** (onlara ibadət edirlər. Tezliklə öz əməllərinin cəzasına görə onlara əzab nazil olacağını) **biləcəklər.**

*(***Qeyd:*** Məkkədə Qüreyşin böyüklərindən olub Hz. Peyğəmbərə istehza edənlər bu 5 nəfər idi: 1-Vəlid ibn Müğirə, 2-As ibn Vail, 3-Əsvəd ibn Əbdi-Yəğus, 4- Əsvəd ibnül-Müttəlib, 5- Haris ibn Tilatla. Allah-Təala Bədir qəzvəsindən qabaq bu 5 nəfərin hamısına bəla göndərib onları həlak etdi. Vəlid ibn Müğirə bir ox düzəldənin yanından keçəndə əynində bürüncək olduğu halda ox onun ayaqlarına dəyib yaraladı, təkəbbüründən aşağı əyilib oxu ayaqlarından çıxarmayıb, o yaradan da həlak oldu. As ibn Vailin ayağına bir tikan batdı, dedi ki, məni ilan çaldı, ilanı axtarıb tapmadılar, ayağı şişib bir dəvə boynu kimi olub həlak oldu. Əsvəd ibnül-Müttəlibin gözləri kor olub gözlərinin şiddətli ağrısından başını divara çırpıb həlak oldu. Əsvəd ibn Əbdi-Yəğus bir ağacın altında oturmuşdu. Dəli olub başını ağacın kötüyünə, tikanlarına vurub həlak oldu. Haris ibn Tilatla isə beyin qanamasından həlak oldu. Allah-Təalanın istehza edənlərə dediyi söz - ey Məhəmməd, sənə biz kifayət edərik, sözü doğru oldu).*

**97)** (وَلَقَدْ نَعْلَمُ اَنَّكَ يَضٖيقُ صَدْرُكَ بِمَا يَقُولُونَ) - (ey Məhəmməd)**, həqiqətən, biz bilirik ki,** (müşriklərin sənə istehza edib Qurana tənə etməsindən, pis) **sözlərindən qəlbin sıxılır.** (Onların etdiyi əziyyətə səbir edib üzülmə)**.**

**98)** (فَسَبِّحْ بِحَمْدِ رَبِّكَ وَكُنْ مِنَ السَّاجِدٖينَ) - (ey Məhəmməd, qəlbin sıxıldığına görə) **rəbbin Allah-Təalanı həmd ilə zikr edib,** (Onu hər bir eyib və qüsur-

وَاعْبُدْ رَبَّكَ حَتّٰى يَأْتِيَكَ الْيَقِينُ ﴿٩٩﴾

---

dan pak sayıb) **çox səcdə edənlərdən ol** (ki, hüzndən, qəm-qüssədən xilas olasan)**.**

**99)** (وَاعْبُدْ رَبَّكَ حَتّٰى يَأْتِيَكَ الْيَقِينُ) **-** (ey Məhəmməd)**, Allah-Təalaya ibadət edib həmişə onun ibadətində ol ki, yəqin** (mütləq bilgi) **sənə gəlib** (qəlbin aram olsun. Müşriklərin istehza edib məzəmmət etməyinə fikir vermə. Allah-Təala haqqı qalib, onları məğlub edəcəkdir)**.**

Allaha həmd olsun, Hicr surəsinin təfsiri bitdi. Hz. Peyğəmbər buyurubdur: “Hicr surəsini kim oxusa, Allah-Təala ona 10 savab bəxş edər.”




## ƏTA ƏMRULLAH (ən-NƏHL) SURƏSİ

16-cı surədir. Məkkədə nazil olub, 128 ayə, 2840 kəlmə, 7707 hərfdir.

بِسْمِ اللّٰهِ الرَّحْمٰنِ الرَّح۪يمِ. اَتٰٓى اَمْرُ اللّٰهِ فَلَا تَسْتَعْجِلُوهُۜ سُبْحَانَهُ وَتَعَالٰى عَمَّا يُشْرِكُونَ ﴿١﴾ يُنَزِّلُ
الْمَلٰٓئِكَةَ بِالرُّوحِ مِنْ اَمْرِه۪ عَلٰى مَنْ يَشَٓاءُ مِنْ عِبَادِه۪ٓ اَنْ اَنْذِرُٓوا اَنَّهُ لَٓا اِلٰهَ اِلَّٓا اَنَا فَاتَّقُونِ ﴿٢﴾ خَلَقَ
السَّمٰوَاتِ وَالْاَرْضَ بِالْحَقِّۜ تَعَالٰى عَمَّا يُشْرِكُونَ ﴿٣﴾ خَلَقَ الْاِنْسَانَ مِنْ نُطْفَةٍ فَاِذَا هُوَ خَص۪يمٌ مُب۪ينٌ
﴿٤﴾ وَالْاَنْعَامَ خَلَقَهَاۚ لَكُمْ ف۪يهَا دِفْءٌ وَمَنَافِعُ وَمِنْهَا تَأْكُلُونَۖ ﴿٥﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1)** (اَتٰٓى اَمْرُ اللّٰهِ) **-** (ey Məhəmməd)**, Allah-Təalanın** (islamı izhar etmək barəsindəki) **əmri yaxınlaşdı.** (Necə ki Allah-Təaladan sizə islamın qələbəsi vədi verilir, haqdır, vaqe olacaqdır)**.** (فَلَا تَسْتَعْجِلُوهُ) – (islamın tez qalib gəlməsini) **tələm-tələsik xahiş etməyin.** (Allah-Təalanın hikməti nə zaman müvafiq görsə, o zaman vaqe olar)**.** (سُبْحَانَهُ وَتَعَالٰى عَمَّا يُشْرِكُونَ) **- Allah-Təala** (müşriklərin) **Allah-Təalaya şərik qoşmasından uca, pak, müqəddəsdir.**

**2)** (يُنَزِّلُ الْمَلٰٓئِكَةَ بِالرُّوحِ مِنْ اَمْرِه۪ عَلٰى مَنْ يَشَٓاءُ مِنْ عِبَادِه۪ٓ) **- Allah-Təala mələkləri öz əmrindən olan** (cəhalətlə ölən qəlbləri dirildən) **ruhuyla** (sözləriylə) **istədiyinə göndərib,** (onu peyğəmbər edər)**.** (اَنْ اَنْذِرُٓوا اَنَّهُ لَٓا اِلٰهَ اِلَّٓا اَنَا فَاتَّقُونِ) **-** (Allah-Təala peyğəmbərlərə mələkləri nazil edib ondan sonra peyğəmbərlərə buyurur ki, insanları belə) **qorxudun: Məndən başqa heç bir** (haqq və yeganə olan) **məbud yoxdur,** (qorxub mənə sitayiş edin, bütləri tərk edin)**.**

**3)** (خَلَقَ السَّمٰوَاتِ وَالْاَرْضَ بِالْحَقِّ تَعَالٰى عَمَّا يُشْرِكُونَ) **- Allah-Təala səmaları və yeri şəriksiz** (haqq olaraq) **yaratdı. Allah-Təala ona şərik qoşulan şeylərdən ucadır.**

**4)** (خَلَقَ الْاِنْسَانَ مِنْ نُطْفَةٍ) **- Allah-Təala insanı spermadan yaratdı** (فَاِذَا هُوَ خَص۪يمٌ مُب۪ينٌ) – (spermadan dönüb kamil və aqil, gözəl insan olub) **qəfildən** (öz rəbbi Allah-Təalanı inkar edib ona) **açıq-aşkar düşmən olub** (şərik qoşdu)**.**

**5)** (وَالْاَنْعَامَ خَلَقَهَا) **- Allah-Təala heyvanları** (dəvəni, öküzü, qoyunu, keçini) **sizdən ötrü** (insanların məsləhət və mənfəətindən ötrü) **yaratdı.** (لَكُمْ ف۪يهَا دِفْءٌ وَمَنَافِعُ) **-** (onların yununda) **sizi** (soyuqdan) **qoruyan** (libas və südlərindən, balalarından başqa da bir çox) **mənfəətlər vardır.** (وَمِنْهَا تَأْكُلُونَ) **– həm də onların** (ətindən) **yeyirsiniz.**

وَلَكُمْ فِيهَا جَمَالٌ حِينَ تُرِيحُونَ وَحِينَ تَسْرَحُونَ ﴿٦﴾ وَتَحْمِلُ اَثْقَالَكُمْ اِلٰى بَلَدٍ لَمْ تَكُونُوا بَالِغِيهِ اِلَّا بِشِقِّ الْاَنْفُسِ اِنَّ رَبَّكُمْ لَرَؤُفٌ رَحِيمٌ ﴿٧﴾ وَالْخَيْلَ وَالْبِغَالَ وَالْحَمِيرَ لِتَرْكَبُوهَا وَزِينَةً وَيَخْلُقُ مَا لَا تَعْلَمُونَ ﴿٨﴾

---

**6)** (وَلَكُمْ فِيهَا جَمَالٌ حِينَ تُرِيحُونَ) **- sizdən ötrü** (iki vaxtda) **bir - axşam vaxtı** (o heyvanları çöldən axura) **gətirdikdə,** (وَحِينَ تَسْرَحُونَ) **- bir də səhər vaxtı** (onları axurdan çıxarıb otlamaq üçün çölə) **buraxdıqda bir gözəllik vardır,** (bu iki vaxtda həm siz onlara baxanda, həm xalq onlara baxıb sizi vəsf edəndə şad olarsınız)**.**

**7)** (وَتَحْمِلُ اَثْقَالَكُمْ اِلٰى بَلَدٍ) – (o heyvanlardan bəzisi (dəvə, öküz) **sizin ağır yüklərinizi daşıyıb elə bir şəhərə apararlar ki,** (لَمْ تَكُونُوا بَالِغِيهِ اِلَّا بِشِقِّ الْاَنْفُسِ) **- siz özünüz** (məşəqqətli zəhmət çəkib) **yorulmadan** (o ağır yükləri aparıb) **ora çata bilməzdiniz.** (اِنَّ رَبَّكُمْ لَرَؤُفٌ رَحِيمٌ) **- həqiqətən, rəbbiniz Allah-Təala** (sizə qarşı) **mehriban və rəhm edəndir** (ki, sizdən ötrü bu heyvanları yaradıbdır ki, onlarla ehtiyacınızı həll edəsiniz)**.** (Ərəblərin əksəriyyəti heyvandarlıqla məşğul olub, hər bir əməllərində və yeməklərində heyvanlara, onların ətinə, südünə möhtac olduqlarından Allah-Təala onlara minnət edərək bu heyvanları yaratdığını bəyan edir)**.**

**8)** (وَالْخَيْلَ وَالْبِغَالَ وَالْحَمِيرَ لِتَرْكَبُوهَا وَزِينَةً) **- Allah-Təala sizdən ötrü** (atı, qatırı və ulağı) **yaratdı ki, ehtiyac məqamında onlara minəsiniz. Bir də sizdən ötrü dünya zinəti olsun.** (Həqiqətən, bu heyvanların varlığında onları yaxşı şəkildə saxlayanlardan ötrü böyük zinət vardır. Xüsusən, atın barəsində Hz. Peyğəmbər buyurubdur: "Hər bir xeyir atın alnına bağlıdır." (Buhari, Cihad 43; Müslüm, İmarə 100; Əbu Davud, Cihad 41; Acluni, Kəşful-Xəfa, I/397) Atların cinsi müxtəlif olduğundan ərəb dilində onların müxtəlif adı vardır)**.** (وَيَخْلُقُ مَا لَا تَعْلَمُونَ) – (Allah-Təala siz insanların mənfəətindən ötrü hələ) **bilmədiyiniz necə şeyləri yaradır.** (Əvvəlki ayədə qeyd olunan heyvanların bir neçə mənfəəti bəyan edildi. Onlardan biri də o heyvanların ətini yemək idi. Amma bu ayədə atın, qatırın və ulağın mənfəətinin minilmək və gözəllik olduğunu göstərməklə onların ətinin haram olduğu məlum olur, gərək, belə də olsun. İnsanlar bu heyvanlara hər bir zəhmətli və məşəqqətli əməllərində möhtac olduqlarından onları kəsib ətini yemək şəriət tərəfindən haram sayılmaqdan başqa insan təbiətinə də ziddir. Qurani-Şərifdə bu 3 heyvanın ətinin halal olmağına dair aşkar bir dəlil yoxdur. Bəlkə, bu ayədən haram olduqları məlum olur, amma bu barədə müxtəlif hədislər olduğundan üləmaların fitvaları da müxtəlifdir. İmam Malik və Əbu Hənifə bu 3 heyvanın ətinin haram olması haqda fətva veriblər. Qurani-Şərif də bunun haramlığını göstərir. İmam Şafii və imam Əhməd ibn Hənbəl at ətinin halal, amma qatır və ulaq ətinin haram olması haqda fitva

وَعَلَى اللّٰهِ قَصْدُ السَّبِيلِ وَمِنْهَا جَٓائِرٌۜ وَلَوْ شَٓاءَ لَهَدٰيكُمْ اَجْمَع۪ينَ ﴿٩﴾ هُوَ الَّذ۪ٓي اَنْزَلَ مِنَ السَّمَٓاءِ مَٓاءً لَكُمْ مِنْهُ شَرَابٌ وَمِنْهُ شَجَرٌ ف۪يهِ تُس۪يمُونَ ﴿١٠﴾ يُنْبِتُ لَكُمْ بِهِ الزَّرْعَ وَالزَّيْتُونَ وَالنَّخ۪يلَ وَالْاَعْنَابَ وَمِنْ كُلِّ الثَّمَرَاتِۜ اِنَّ ف۪ي ذٰلِكَ لَاٰيَةً لِقَوْمٍ يَتَفَكَّرُونَ ﴿١١﴾

---

veriblər. Şiə imamiyyə üləması hər 3 heyvanın ətinin “məkruh” (caiz olmayan) olması haqda fitva veriblər (Kuleyni, Kafi (Furu), II/151; Tusi, Tehzib, IX/40). Əbu Hənifə məzhəbində olan Tatarıstan müsəlmanlarının arasında at əti yemək adət olub hətta böyük qonaqlıqlarında və toy ziyafətlərində qiymətli atları kəsmək onlardan ötrü böyük iftixar hesab olunur. Tatarıstan camaatı islam ümmətinin içində son dərəcə cahil, nadan və elmsiz bir xalq olub aralarında elm əhli olmadığından alim surətində olan cahil şəxslər xalqı zəlalətə salıblar, imam Əbu Hənifənin fitvasını dərk etmək onlara çətin olub xalqı Quranın və Əbu Hənifənin fitvasının xilafına iş görməyə vadar edirlər. İmam Şafiinin fitvası at ətinin halallığı yönündə olsa da, Şafii məzhəbində olanların arasında at əti yemək adət deyildir. Qeyd olunan məzhəblərdən imam Malik və imam Əbu Hənifənin məzhəbləri Qurana müvafiqdir**).**

**9)** (وَعَلَى اللّٰهِ قَصْدُ السَّبِيلِ) – (haqqa qovuşduran) **düz yolu** (insanlara) **göstərib** (hidayət etmək) **Allah-Təalaya aiddir.** (Necə ki Allah-Təala peyğəmbər və kitab göndərib hidayət edibdir**).** (وَمِنْهَا جَٓائِرٌ) **- amma o yollardan bəzisi düz olmayıb** (haqdan kənar yoldur. O yol Allah-Təalanın yolu deyil, o yoldan gərək kənar olasınız**).** (وَلَوْ شَٓاءَ لَهَدٰيكُمْ اَجْمَع۪ينَ) **- əgər Allah-Təala istəsə, hamınıza zorla hidayət edib** (haqqa qovuşdurar. Lakin sizi azad yaratdığından sizi öz ixtiyarınıza buraxıb, imana gərək öz ixtiyarınızla daxil olasınız**).**

**10)** (هُوَ الَّذ۪ٓي اَنْزَلَ مِنَ السَّمَٓاءِ مَٓاءً لَكُمْ) – (Allah-Təala sizə lütf edib) **sizdən ötrü səmadan su göndərdi.** (مِنْهُ شَرَابٌ) – (o sudan) **bəzisi var ki,** (yerdəki maddələrin təsirilə dadı dəyişməyib, saf və dadlı halda qalıb) **ondan içirsiniz.** (وَمِنْهُ شَجَرٌ) – (o sudan) **bəzisi** (çöllərə axdığından içində heyvanatı otardığınız) **ağaclar** (göyərər**).** (ف۪يهِ تُس۪يمُونَ) – (o otluqlarda heyvanlarınızı) **otarırsınız.**

**11)** (يُنْبِتُ لَكُمْ بِهِ الزَّرْعَ) – (Allah-Təala səmadan gələn o suyun səbəbinə) **sizdən ötrü** (hər cür) **əkin göyərdir.** (وَالزَّيْتُونَ) **- zeytun** (ağacını yetişdirir ki, onun yağından mənfəət əldə edəsiniz**).** (وَالنَّخ۪يلَ) **- və xurma ağacını** (yetişdirir ki, onun özündən və meyvəsindən çox fayda alasınız**).** (وَالْاَعْنَابَ) **- üzüm ağacını** (yetişdirir ki, ondan faydalanasınız**).** (وَمِنْ كُلِّ الثَّمَرَاتِ) **- və** (sizdən ötrü) **hər cür meyvələrdən yetişdirir.** (اِنَّ ف۪ي ذٰلِكَ لَاٰيَةً لِقَوْمٍ يَتَفَكَّرُونَ) **- bu** (qeyd olunan meyvələrdə - Allah-Təalanın hikmət və qüdrətini) **düşünən camaatlardan ötrü dəlil və sübutlar var,** (bilərlər ki, Allah-Təala insanlardan ötrü növbənöv meyvələri və heyvanatdan ötrü ot-ələfi hansı hikmət üzrə yaradır**).**

وَسَخَّرَ لَكُمُ الَّيْلَ وَالنَّهَارَ ۙ وَالشَّمْسَ وَالْقَمَرَ ۖ وَالنُّجُومُ مُسَخَّرَاتٌ بِاَمْرِهٖ ۗ اِنَّ فِي ذٰلِكَ لَاٰيَاتٍ لِقَوْمٍ يَعْقِلُونَ ۙ ﴿١٢﴾ وَمَا ذَرَاَ لَكُمْ فِي الْاَرْضِ مُخْتَلِفًا اَلْوَانُهُ اِنَّ فِي ذٰلِكَ لَاٰيَةً لِقَوْمٍ يَذَّكَّرُونَ ﴿١٣﴾ وَهُوَ الَّذِي سَخَّرَ الْبَحْرَ لِتَأْكُلُوا مِنْهُ لَحْمًا طَرِيًّا وَتَسْتَخْرِجُوا مِنْهُ حِلْيَةً تَلْبَسُونَهَا ۚ وَتَرَى الْفُلْكَ مَوَاخِرَ فِيهِ

---

**12)** (وَسَخَّرَ لَكُمُ الَّيْلَ وَالنَّهَارَ ۙ وَالشَّمْسَ وَالْقَمَرَ) **- Allah-Təala gecə və gündüzü sizin** (xidmətinizə verib) **ram etdi** (ki, birində rahat olub, o birində məişətinizlə məşğul olasınız) **və günəşi və ayı sizə tabe etdi** (ki, onların təsirindən yer üzündə məişət və güzəranınızla bağlı olan şeylər meydana gəlib onlardan faydalanasınız)**.** (وَالنُّجومُ مُسَخَّرَاتٌ بِاَمْرِهٖ) **- bütün ulduzlar Allah-Təalanın əmrinə tabe olub** (sakin və ya hərəkətli olmaları Allah-Təalanın iradəsinə bağlıdır. Bu ayə filosofların və münəccimlərin iddiasını rədd edir. Hansı ki ulduzların bu aləmə müstəqil şəkildə təsir etdiyinə inanırlar)**.** (اِنَّ فِي ذٰلِكَ لَاٰيَاتٍ لِقَوْمٍ يَعْقِلُونَ) **- bu** (qeyd olunan şeylərdə Allah-Təalanın tövhid, qüdrət və hikmətini) **ağılla düşünən camaatlardan ötrü dəlil və sübutlar vardır.** (Gərək ağılla hərəkət edib nəfsani arzulara tabe olmasınlar)**.**

**13)** (وَمَا ذَرَاَ لَكُمْ فِي الْاَرْضِ مُخْتَلِفًا اَلْوَانُهُ) – (Allah-Təala yer üzündə müxtəlif rəngdə və təbiətdə olan hər cür heyvan, meyvə və ağacları)**, rəngarəng şeyləri sizin üçün yaratdı,** (yer üzündə bu qədər çox məxluqun var olmasına baxmayaraq, eyni cinsin nümayəndələrinin bir-birinə oxşar olub fərqlənməməsi yeganə olan Allah-Təalanın qadir və hökmran olduğuna açıq-aşkar dəlil və sübutdır)**.** (اِنَّ فِي ذٰلِكَ لَاٰيَةً لِقَوْمٍ يَذَّكَّرُونَ) **- həqiqətən, bu** (qeyd olunan şeylərdə Allah-Təalanın qüdrət və hikmətini düşünüb) **ibrət alan bir camaatdan ötrü dəlil və sübutlar vardır.**

**14)** (وَهُوَ الَّذِي سَخَّرَ الْبَحْرَ لِتَأْكُلُوا مِنْهُ لَحْمًا طَرِيًّا) **- Allah-Təala** (öz kamil qüdrəti ilə) **dənizi sizin** (xidmətinizə verib) **ram etdi ki,** (o zəhər kimi acı suyun içində yaratdığı incə və yağlı balıqları ordan çıxarıb) **onların təzə ətindən yeyəsiniz.** (Bu ayə dənizdən çıxan hər cür balığın halal olmasına işarə edir, müsəlmanların böyük bir qismi bu ayəyə əsaslanıb, dənizdən çıxan hər bir balığı halal bilib yeyirlər, amma bir qrup da pullu balığı halal, pulsuz balığı haram sayıb, bu barədə yəhudilərlə şərik olub, balıq barəsində bəzi hədislərə və Tövratda qeyd olunan ayəyə tabe olublar (Əbu Davud, Təharət, 41; Tirmizi, Təharət, 52; İbn Macə, Təharət, 38). Çünki Qurani-Şərifin nəsx etmədiyi Tövrat hökmləri-lə əməl edilə bilər.)**.** (وَتَسْتَخْرِجُوا مِنْهُ حِلْيَةً تَلْبَسُونَهَا) – (yenə o acı dənizdən) **zinət** (mirvari və mərcan) **çıxarıb,** (onları arvadlarınız özlərinə) **zinət edirlər.** (Belə cövhərlərin acı su içində yaradılması Allah-Təalanın qüdrətinə böyük dəlil deyilmi?) (وَتَرَى الْفُلْكَ مَوَاخِرَ فِيهِ) - (ey Məhəmməd)**, gəmiləri görürsən ki,** (Allah-

**وَلِتَبْتَغُوا مِنْ فَضْلِهِ وَلَعَلَّكُمْ تَشْكُرُونَ ﴿١٤﴾ وَاَلْقٰى فِي الْاَرْضِ رَوَاسِيَ اَنْ تَمِيدَ بِكُمْ وَاَنْهَارًا وَسُبُلًا لَعَلَّكُمْ تَهْتَدُونَۙ ﴿١٥﴾ وَعَلَامَاتٍ وَبِالنَّجْمِ هُمْ يَهْتَدُونَ ﴿١٦﴾ اَفَمَنْ يَخْلُقُ كَمَنْ لَا يَخْلُقُ اَفَلَا تَذَكَّرُونَ ﴿١٧﴾**

---

Təalanın qüdrətiylə) **dənizdə üzüb hərəkət edirlər** (وَلِتَبْتَغُوا مِنْ فَضْلِهِ) **- ki,** (o gəmilərin səbəbinə ticarət edib) **Allah-Təalanın lütfündən ruzi** (istəyib) **axtarasınız.** (وَلَعَلَّكُمْ تَشْكُرُونَ) **- əlbəttə, gərək** (bu nemətlərin səbəbinə Allah-Təalaya) **şükür edəsiniz.**

**15)** (وَاَلْقٰى فِي الْاَرْضِ رَوَاسِيَ اَنْ تَمِيدَ بِكُمْ) – (yer yüngül olub, o tərəf-bu tərəfə hərəkət edib, orada rahat olmamaqdan qorxmayasınız və) **sizi sarsmasın deyə** (Allah-Təala yeri düz yaradıb)**, yer üzünə böyük və ağır dağlar saldı** (ki, dağları görüb rahat olasınız və yəqin edəsiniz ki, yer titrəməyib, bəlkə möhkəm və bərqərar olacaqdır. (Bəzən yer kürəsinin dibində meydana gələn hadisələr səbəbilə zəlzələnin baş verməsi bu işin xaricindədir)**.** (وَاَنْهَارًا) – (ondan sonra Allah-Təala yerdə) **çaylar** (yaratdı ki, əkin işində onlardan mənfəət əldə edəsiniz)**,** (وَسُبُلًا) – (Allah-Təala dağları, çayları yaradandan sonra onların arasında sizdən ötrü) **yollar** (saldı ki, o yollarla məqsədinizə doğru özgə məmləkətlərə tərəf gedib arzunuza çatasınız)**.** (لَعَلَّكُمْ تَهْتَدُونَ) **- əlbəttə,** (siz gərək bu qeyd olunan dəlillərlə) **hidayət tapıb** (Allah-Təalanın tövhidinə yol tapıb haqqa qovuşasınız)**.**

**16)** (وَعَلَامَاتٍ) – (insanların getdikləri yollarda Allah-Təala onlardan ötrü dağlardan və başqa şeylərdən) **əlamətlər** (qoydu ki, o əlamətlər sayəsində yoldan çıxıb azmasınlar)**,** (وَبِالنَّجْمِ هُمْ يَهْتَدُونَ) – (gecə vaxtı* özgə əlamətlər onlara məxfi qalanda onlardan ötrü) **ulduzlar** (nə gözəl əlamət olub)**, onlarla** (yolu tapıb) **hidayətə çatarlar.**

*(*Qeyd: Astronomiya elmi, onun yardımı ilə - ulduzları tanıyıb onların halına, xüsusiyyətinə, səyyarələrin keçdiyi yollara agah olmaq nə gözəl elmdir, ulduzlar, səyyarələr gecə vaxtı yollardan ötrü əlamət, bələdçi olmaqdan başqa müqəddəs, pak yaradıcını tanımaq üçün də böyük dəlillərdən biridir. Astronomiya nə şirin elmdir, əgər bu elmin vasitəsilə ulduzların adlarına, onların bir-birilərilə olan əlaqəsinə agah olub, qış fəslində, ya da yay fəslində gecə havanın saf və təbiətin sakit olan vaxtında üzünü səmaya döndərib ulduzların bir-biriləri ilə olan əlaqəsinə, hallarına baxıb anlasan, için elə fərəhlənər ki, insan o anda özündə olmadan "la ilahə illallah" deyər, yeri və göyləri yaradan Xaliqi təqdis və tənzih edib ona sitayiş edər).*

**17)** (اَفَمَنْ يَخْلُقُ كَمَنْ لَا يَخْلُقُ) – (ey müşriklər, məxluqatı) **yaradan Allah-Təala məgər heç bir şey yaratmağa qüdrəti olmayan o bütlər kimidir?** (اَفَلَا تَذَكَّرُونَ) **– bəs** (fikir verib) **ibrət almazsınız** (ki, o bütləri tərk edib yeganə və hər bir şeyin yaradıcısı olana itaət və ibadət edəsiniz?)

وَاِنْ تَعُدُّوا نِعْمَةَ اللّٰهِ لَا تُحْصُوهَاۜ اِنَّ اللّٰهَ لَغَفُورٌ رَح۪يمٌ ﴿١٨﴾ وَاللّٰهُ يَعْلَمُ مَا تُسِرُّونَ وَمَا تُعْلِنُونَ
﴿١٩﴾ وَالَّذ۪ينَ يَدْعُونَ مِنْ دُونِ اللّٰهِ لَا يَخْلُقُونَ شَيْـًٔا وَهُمْ يُخْلَقُونَۜ ﴿٢٠﴾ اَمْوَاتٌ غَيْرُ اَحْيَٓاءٍۚ وَمَا
يَشْعُرُونَۙ اَيَّانَ يُبْعَثُونَ۟ ﴿٢١﴾ اِلٰهُكُمْ اِلٰهٌ وَاحِدٌۚ فَالَّذ۪ينَ لَا يُؤْمِنُونَ بِالْاٰخِرَةِ قُلُوبُهُمْ مُنْكِرَةٌ وَهُمْ
مُسْتَكْبِرُونَ ﴿٢٢﴾ لَا جَرَمَ اَنَّ اللّٰهَ يَعْلَمُ مَا يُسِرُّونَ وَمَا يُعْلِنُونَۜ اِنَّهُ لَا يُحِبُّ الْمُسْتَكْبِر۪ينَ ﴿٢٣﴾

---

**18)** (وَاِنْ تَعُدُّوا نِعْمَةَ اللّٰهِ لَا تُحْصُوهَا) **- əgər Allah-Təalanın** (sizə bəxş etdiyi) **nemətləri saymağa çalışsanız, sayıb bitirə bilməzsiniz.** (اِنَّ اللّٰهَ لَغَفُورٌ رَح۪يمٌ) **- həqiqətən, Allah-Təala** (nemət müqabilində şükür və tövbə edənlərin təqsirini) **bağışlayıb, rəhm edəndir,** (sizə olan nemətini kəsməz)**.**

**19)** (وَاللّٰهُ يَعْلَمُ مَا تُسِرُّونَ وَمَا تُعْلِنُونَ) – (nə istəyirsinizsə edin, heç bir əməl Allah-Təalaya məxfi qalmaz)**. Nəyi gizlədirsiniz və nəyi aşkar edirsinizsə, Allah-Təala ondan agahdır,** (hamısının qarşılığını sizə verəcəkdir)**.**

**20)** (وَالَّذ۪ينَ يَدْعُونَ مِنْ دُونِ اللّٰهِ) - (ey Məhəmməd)**, Allah-Təaladan başqa çağırıb sitayiş etdikləri** (o bütlər)**,** (لَا يَخْلُقُونَ شَيْـًٔا وَهُمْ يُخْلَقُونَ) **- heç bir şey yaratmağa qadir olmayıb özləri Allah-Təalanın yaratdığı məxluqlardır.** (Məxluq xaliq ola bilməz)**.**

**21)** (اَمْوَاتٌ غَيْرُ اَحْيَٓاءٍ) – (əgər o bütlər, həqiqətən, Allah olsaydılar, gərək onlar həmişə diri olub ölməyəydilər, halbuki o bütlər) **ölüdürlər** (cansız şeydirlər)**, diri deyillər.** (وَمَا يَشْعُرُونَ اَيَّانَ يُبْعَثُونَ) – (o bütlər onlara ibadət edənlərin haqq-hesabdan ötrü) **nə vaxt diriləcəyinə də agah olmazlar.** (Necə ola bilir ki, belə şeyləri Allah-Təalaya şərik qoşub özlərinə məbud saysınlar?)

**22)** (اِلٰهُكُمْ اِلٰهٌ وَاحِدٌ) – (bütlərin məbudluğunun batil olması artıq məlum oldu)**, sizin** (haqq olan) **məbudunuz yeganə Allah-Təaladır,** (onun şəriki və oxşarı yoxdur. İbadət və itaət ancaq ona layiqdır, ondan başqasına batildir)**.** (فَالَّذ۪ينَ لَا يُؤْمِنُونَ بِالْاٰخِرَةِ) – (Allah-Təalanın tövhidinə)**, qiyamət gününə iman gətirməyənlərin,** (قُلُوبُهُمْ مُنْكِرَةٌ وَهُمْ مُسْتَكْبِرُونَ) **- qəlbləri** (Allah-Təalanın tövhidini və axirəti) **inkar edib** (qəbul etmir)**, özləri də təkəbbürlüdürlər.**

**23)** (لَا جَرَمَ اَنَّ اللّٰهَ يَعْلَمُ مَا يُسِرُّونَ وَمَا يُعْلِنُونَ) – (Allah-Təalaya və axirət gününə iman gətirməyənlərin) **gizlin və aşkar əməllərinə Allah-Təala şübhəsiz ki, agahdır, öz əməllərinin cəzasını onlara verəcəkdir.** (اِنَّهُ لَا يُحِبُّ الْمُسْتَكْبِر۪ينَ) **- həqiqətən, Allah-Təala təkəbbürlənənləri sevməz.** (Hz. Peyğəmbər buyurubdur ki, Allah-Təala təkəbbürlüləri qiyamət günündə qarışqa surətində diriildər ki, məhşər əhli onları ayaqlarıyla tapdalasın. Təkəbbürlü şəxs dünyada öz həmcinsi insanı narahat edib, təkəbbürləndiyi üçün Allah-Təala ona əzab edib kiçik heyvan surətində onu dirildər. Başqa bir hədisdə Hz. Peyğəmbər buyurubdur ki, kim təvazökarlıq etsə, Allah-Təala onu ucaldar (Müslüm,

وَاِذَا قٖيلَ لَهُمْ مَاذَٓا اَنْزَلَ رَبُّكُمْۙ قَالُوٓا اَسَاطٖيرُ الْاَوَّلٖينَۙ ﴿٢٤﴾ لِيَحْمِلُوٓا اَوْزَارَهُمْ كَامِلَةً يَوْمَ الْقِيٰمَةِۙ وَمِنْ اَوْزَارِ الَّذٖينَ يُضِلُّونَهُمْ بِغَيْرِ عِلْمٍۜ اَلَا سَٓاءَ مَا يَزِرُونَ۟ ﴿٢٥﴾ قَدْ مَكَرَ الَّذٖينَ مِنْ قَبْلِهِمْ فَاَتَى اللّٰهُ بُنْيَانَهُمْ مِنَ الْقَوَاعِدِ فَخَرَّ عَلَيْهِمُ السَّقْفُ مِنْ فَوْقِهِمْ وَاَتٰيهُمُ الْعَذَابُ مِنْ حَيْثُ لَا يَشْعُرُونَ ﴿٢٦﴾

---

Birr 69; Tirmizi, Birr 82). Kim də təkəbbürlənsə, Allah-Təala onu zəlil edər (Əhməd bin Hənbəl, Müsnəd, III/76)).

**24)** (وَاِذَا قٖيلَ لَهُمْ مَاذَٓا اَنْزَلَ رَبُّكُمْ)– (kənar şəxslər Məkkəyə gələndə məkkəli Qüreyş camaatından Hz. Peyğəmbərin əhvalatını soruşub) **deyəndə ki, sizin rəbbiniz Allah-Təala sizə** (peyğəmbər göndərib)**, nə nazil edib?** (Bizə bəyan edin)**.** (قَالُوٓا اَسَاطٖيرُ الْاَوَّلٖينَ) – (onların cavabında Məkkə əhli) **dedilər:** (bir şey yoxdur, bu, ondan) **əvvəlki** (ümmətlərin batil söz və) **əfsanələri,** (hekayələridir)**.**

**25)** (لِيَحْمِلُوٓا اَوْزَارَهُمْ كَامِلَةً يَوْمَ الْقِيٰمَةِ) – (bu sözü deyib xalqı zəlalətə salıb Allah-Təalaya və Hz. Peyğəmbərə iman gətirmələrinə mane oldular)**. Qiyamət günü öz günahlarının hamısını daşıyıb** (əzaba düçar olarlar)**.** (وَمِنْ اَوْزَارِ الَّذٖينَ يُضِلُّونَهُمْ بِغَيْرِ عِلْمٍ) **– və zəlalətə saldıqları elmsiz,** (cahil) **şəxslərin də** (günahına şərik olub) **günahlarının bir qismini yüklənib** (onların da əvəzinə əzaba düçar olarlar)**.** (Ayədən belə məlum olur ki, öz rəislərinin azdırması və zəlalətə salması ilə asi olub zəlalətə düşən elmsiz cahillər üzrsüz olmayıb, haqla batil arasında fərqi görməyib, düşünmədən rəislərə tabe olduqlarından əzaba düçar olacaqlar)**.** (اَلَا سَٓاءَ مَا يَزِرُونَ) **-** (ey Məhəmməd)**, xəbərdar ol ki,** (bu Qüreyş camaatının) **daşıdığı** (günah) **nə pis şeydir.** (Öz günahlarından başqa, özgə şəxsləri də zəlalətə salıb onların günahını da yüklənib, bu səbəbdən əzab çəkmək nə pis şeydir. Bu Qüreyş camaatı özləri iman gətirmədilər, heç olmasa, özgələrini zəlalətə salıb, onların günahını yüklənib, bu səbəbdən əzab çəkməsinlər. Ağıllı şəxs də belə əməl edərmi?)

**26)** (قَدْ مَكَرَ الَّذٖينَ مِنْ قَبْلِهِمْ) **-** (ey Məhəmməd, sən bu Qüreyş camaatının məkr və hiyləsinə görə qəmgin olma)**, həqiqətən, onlardan əvvəlkilər də məkr, hiylə etdilər** (ki, Allah-Təalanın dinini batil edib, peyğəmbərinə zərər yetirsinlər. Möhkəm binalar tikdilər ki, o binaların sayəsində Allah-Təalanın əzabından qurtulub salamat qalsınlar. Babil padşahı Nəmrudun zamanında Hz. İbrahim onun özünə və qövmünə peyğəmbər olaraq göndərildi. Nəmrud 5 min arşın hündürlükdə möhkəm bir qəsr tikdirdi. Elə ki Allah-Təalaya iman gətirmədilər, Allah-Təala fırtına və zəlzələ göndərib onun qəsrini və digər evləri xarab edib həlak oldular. Necə ki buyurur:) (فَاَتَى اللّٰهُ بُنْيَانَهُمْ مِنَ الْقَوَاعِدِ) **- Allah-Təalanın** (əmri gəlib, onların möhkəm) **binalarını** (kökündən yıxıb) **xarab etdi.** (فَخَرَّ عَلَيْهِمُ السَّقْفُ مِنْ فَوْقِهِمْ) – (xarab olan zaman) **evlərinin tavanı üzərilərinə tökülüb** (hamısı həlak oldu)**.** (وَاَتٰيهُمُ الْعَذَابُ مِنْ حَيْثُ لَا يَشْعُرُونَ) – (qəsr-

ثُمَّ يَوْمَ الْقِيٰمَةِ يُخْزِيهِمْ وَيَقُولُ اَيْنَ شُرَكَآءِيَ الَّذِينَ كُنْتُمْ تُشَآقُّونَ فِيهِمْ قَالَ الَّذِينَ اُوتُوا الْعِلْمَ اِنَّ الْخِزْيَ الْيَوْمَ وَالسُّوٓءَ عَلَى الْكَافِرِينَ ﴿٢٧﴾ اَلَّذِينَ تَتَوَفّٰيهُمُ الْمَلٰٓئِكَةُ ظَالِمٖٓي اَنْفُسِهِمْ فَاَلْقَوُا السَّلَمَ مَا كُنَّا نَعْمَلُ مِنْ سُوٓءٍ بَلٰٓى اِنَّ اللّٰهَ عَلِيمٌ بِمَا كُنْتُمْ تَعْمَلُونَ ﴿٢٨﴾ فَادْخُلُوٓا اَبْوَابَ جَهَنَّمَ خَالِدِينَ فِيهَا فَلَبِئْسَ مَثْوَى الْمُتَكَبِّرِينَ ﴿٢٩﴾ وَقِيلَ لِلَّذِينَ اتَّقَوْا مَاذَآ اَنْزَلَ رَبُّكُمْ

---

lərin və evlərin möhkəmliyinə arxayın olub**), güman etmədikləri yerdən onlara əzab gəlib** (hamısı həlak oldu. Ey Məhəmməd, bu Qüreyş camaatına da güman etmədikləri yerdən əzab gəlib hamısı həlak və zəlil olacaqlar. Sən səbir edib Allah-Təalaya təvəkkül et. Allah-Təala vədinə sadiq olub, əvvəlcə Bədir savaşında müsəlmanları Qüreyşə hakim edib, bəzisi öldürülüb, bəzisi əsir olub zəlil oldular. Ondan sonra hicrətin 8-ci ilində Məkkə müsəlmanların əli ilə fəth olunub, müşriklərin hamısı zəlil olub bir nəfəri də sağ qalmadı)**.**

**27)** (ثُمَّ يَوْمَ الْقِيٰمَةِ يُخْزِيهِمْ) – (Allah-Təala onları bu dünyada əzaba düçar edəndən) **sonra qiyamət gününün** (əzabıyla) **onları zəlil edər.** (وَيَقُولُ اَيْنَ شُرَكَآءِيَ الَّذِينَ كُنْتُمْ تُشَآقُّونَ فِيهِمْ) – (Allah-Təala qiyamət günündə onlara) **deyər: barələrində** (möminlərlə) **mübahisə, düşmənçilik edib mənə şərik saydığınız** (o bütlər) **hanı?** (قَالَ الَّذِينَ اُوتُوا الْعِلْمَ) – (qiyamət günündə Allah-Təala kafir və müşriklərə bu sualı verəndə onların cavab verməyə və danışmağa gücləri olmaz)**. Elm sahibləri** (peyğəmbərlər və möminlər onların əvəzində belə) **deyərlər:** (اِنَّ الْخِزْيَ الْيَوْمَ وَالسُّوٓءَ عَلَى الْكَافِرِينَ) – (ilahi, bugünkü gündə bunlar sənə nə cavab versinlər? Sənin vədinə görə) **həqiqətən, bu gün kafirlər zillət və əzaba düçar olacaq.**

**28)** (اَلَّذِينَ تَتَوَفّٰيهُمُ الْمَلٰٓئِكَةُ ظَالِمٖٓي اَنْفُسِهِمْ) – **özlərinə qarşı zalım** (müşrik) **olanları** (Allah-Təalanın izniylə) **mələklər öldürdükdə,** (فَاَلْقَوُا السَّلَمَ مَا كُنَّا نَعْمَلُ مِنْ سُوٓءٍ) – (ölüm onlara gələndən sonra dünyada etdikləri təkəbbürü bir kənara qoyub itaət edib) **deyərlər: "Biz dünyada heç bir pis əməl etməyib** (müşrik olmamışıq. Əzab qorxusundan dünyada Allaha şirk qoşmalarını inkar edərlər)**."** (بَلٰٓى) – (onların cavabında Allah-Təala deyər: əlbəttə, dünyada pis əməl edib müşrik olubsunuz, indi inkar etmək sizə bir fayda verməz)**.** (اِنَّ اللّٰهَ عَلِيمٌ بِمَا كُنْتُمْ تَعْمَلُونَ) **- həqiqətən, Allah-Təala** (dünyada) **etdiklərinizə agahdır.** (Sizin inkar etməyinizin bir faydası yoxdur)**.**

**29)** (فَادْخُلُوٓا اَبْوَابَ جَهَنَّمَ خَالِدِينَ فِيهَا) **- cəhənnəmin qapıları** (üzünüzə açıqdır, hansı birindən istəyirsinizsə)**, daxil olun, həmişə** (cəhənnəmdə) **olub** (oradan çıxan deyilsiniz)**.** (فَلَبِئْسَ مَثْوَى الْمُتَكَبِّرِينَ) – **təkəbbürlənib imana daxil olmayan şəxslərin məskəni** (yəni cəhənnəm) **necə də pisdir.**

**30)** (وَقِيلَ لِلَّذِينَ اتَّقَوْا مَاذَآ اَنْزَلَ رَبُّكُمْ) – (Məkkə ətrafından gələn şəxslər Hz. Peyğəmbərin əhvalatını imana daxil olan) **müttəqi şəxslərdən soruşub dedilər:**

قَالُوا خَيْرًاۜ لِلَّذٖينَ اَحْسَنُوا فٖي هٰذِهِ الدُّنْيَا حَسَنَةٌۜ وَلَدَارُ الْاٰخِرَةِ خَيْرٌۜ وَلَنِعْمَ دَارُ الْمُتَّقٖينَۙ ﴿٣٠﴾
جَنَّاتُ عَدْنٍ يَدْخُلُونَهَا تَجْرٖي مِنْ تَحْتِهَا الْاَنْهَارُ لَهُمْ فٖيهَا مَا يَشَٓاؤُ۫نَۜ كَذٰلِكَ يَجْزِي اللّٰهُ الْمُتَّقٖينَۙ ﴿٣١﴾
اَلَّذٖينَ تَتَوَفّٰيهُمُ الْمَلٰٓئِكَةُ طَيِّبٖينَۙ يَقُولُونَ سَلَامٌ عَلَيْكُمُۙ ادْخُلُوا الْجَنَّةَ بِمَا كُنْتُمْ تَعْمَلُونَ ﴿٣٢﴾ هَلْ
يَنْظُرُونَ اِلَّٓا اَنْ تَأْتِيَهُمُ الْمَلٰٓئِكَةُ اَوْ يَأْتِيَ اَمْرُ رَبِّكَۜ كَذٰلِكَ فَعَلَ الَّذٖينَ مِنْ قَبْلِهِمْۜ وَمَا ظَلَمَهُمُ اللّٰهُ وَلٰكِنْ
كَانُٓوا اَنْفُسَهُمْ يَظْلِمُونَ﴿٣٣﴾

---

**sizin rəbbiniz Allah-Təala sizə peyğəmbər göndərib nə** (hökm) **nazil edibdir?”** (قَالُوا خَيْرًا) – (müttəqilər onların cavabında) **dedilər:** (bizim rəbbimiz Allah-Təala peyğəmbəri Məhəmmədə) **xeyir** (yaxşı və gözəl hökmlər, sözlər nazil edibdir). (لِلَّذٖينَ اَحْسَنُوا فٖي هٰذِهِ الدُّنْيَا حَسَنَةٌ) - (o yaxşı, gözəl sözlər budur:) **yaxşı əməl edənlərdən ötrü bu dünyada yaxşı** (savab və qarşılıq) **vardır.** (وَلَدَارُ الْاٰخِرَةِ خَيْرٌ) - **amma axirət evinin** (savab və mükafatı dünyadakı mükafatlardan) **xeyirlidir** (yaxşı və gözəldir. O savabları görəndə dünya mükafatını unudarlar). (وَلَنِعْمَ دَارُ الْمُتَّقٖينَ) - **müttəqilərin axirətdəki evləri nə yaxşıdır, o yaxşı evdə həmişə olub oradan çıxmazlar.**

**31)** (جَنَّاتُ عَدْنٍ يَدْخُلُونَهَا تَجْرٖي مِنْ تَحْتِهَا الْاَنْهَارُ) – (müttəqilərin yaxşı mənzilləri axirətdəki əbədi Ədn) **bağlarıdır. Qəsrlərinin və ağaclarının altından çaylar axan o bağlara daxil olarlar.** (لَهُمْ فٖيهَا مَا يَشَٓاؤُ۫نَ) – **istədikləri hər bir şey** (o anda orada zəhmətsiz olaraq) **onlardan ötrü var olar.** (كَذٰلِكَ يَجْزِي اللّٰهُ الْمُتَّقٖينَ) - **Allah-Təala** (mömin və) **müttəqi şəxslərə belə mükafat verər.**

**32)** (اَلَّذٖينَ تَتَوَفّٰيهُمُ الْمَلٰٓئِكَةُ طَيِّبٖينَ) – (mömin və müttəqi, pak və pakizə olduqları halda Allah-Təalanın izniylə **mələklərin canını aldığı şəxslərə,** (يَقُولُونَ سَلَامٌ عَلَيْكُمُ) – (mələklər) **deyərlər:** (Allah-Təala tərəfindən) **sizə salam olsun.** (ادْخُلُوا الْجَنَّةَ بِمَا كُنْتُمْ تَعْمَلُونَ) – (dünyada etdiyiniz o yaxşı) **əməlləriniz səbəbinə cənnətə daxil olun.**

**33)** (هَلْ يَنْظُرُونَ اِلَّٓا اَنْ تَأْتِيَهُمُ الْمَلٰٓئِكَةُ) - (keçən ayələrdə müşriklərin və möminlərin axirətdəki dərəcələri bəyan edildi. Bu ayədə yenidən müşriklərin əhvalı bəyan edilir). (Ey Məhəmməd, sənə iman gətirməyən bu müşriklər ancaq onların canını alacaq və əbədi əzaba düçar edəcək) **mələkləri gözləyirlər?** (اَوْ يَأْتِيَ اَمْرُ رَبِّكَ) - **yoxsa rəbbin Allah-Təalanın** (onları həlak edəcək əzab) **əmrinin gəlməsini** (gözləyirlər? İman gətirməyən şəxslərdən ötrü bu iki şeydən biri var: ya axirət əzabı, ya da dünya əzabı. Görəsən bunların hansını gözləyirlər?) (كَذٰلِكَ فَعَلَ الَّذٖينَ مِنْ قَبْلِهِمْ) - (ey Məhəmməd, bu müşriklərdən) **əvvəlkilər də bunlar kimi əməl ediblər.** (Kafir olub peyğəmbərləri təkzib ediblər). (وَمَا ظَلَمَهُمُ اللّٰهُ وَلٰكِنْ كَانُٓوا اَنْفُسَهُمْ يَظْلِمُونَ) - **Allah-Təala onlara zülm edib** (əzab göndərməyib), **bəlkə, onlar** (müşrik olmaqla) **özlərinə zülm edib,** (Allah-Təala da onlara əzab göndərib həlak oldular).

فَاَصَابَهُمْ سَيِّئَاتُ مَا عَمِلُوا وَحَاقَ بِهِمْ مَا كَانُوا بِهِ يَسْتَهْزِؤُنَ ﴿٣٤﴾ وَقَالَ الَّذِينَ اَشْرَكُوا لَوْ شَٓاءَ اللّٰهُ مَا
عَبَدْنَا مِنْ دُونِهِ مِنْ شَيْءٍ نَحْنُ وَلَٓا اٰبَٓاؤُنَا وَلَا حَرَّمْنَا مِنْ دُونِهِ مِنْ شَيْءٍ كَذٰلِكَ فَعَلَ الَّذِينَ مِنْ قَبْلِهِمْ
فَهَلْ عَلَى الرُّسُلِ اِلَّا الْبَلَاغُ الْمُبِينُ ﴿٣٥﴾ وَلَقَدْ بَعَثْنَا فِي كُلِّ اُمَّةٍ رَسُولًا اَنِ اعْبُدُوا اللّٰهَ وَاجْتَنِبُوا
الطَّاغُوتَ فَمِنْهُمْ مَنْ هَدَى اللّٰهُ وَمِنْهُمْ مَنْ حَقَّتْ عَلَيْهِ الضَّلَالَةُ فَسِيرُوا فِي الْاَرْضِ فَانْظُرُوا كَيْفَ
كَانَ عَاقِبَةُ الْمُكَذِّبِينَ ﴿٣٦﴾

---

**34)** (فَاَصَابَهُمْ سَيِّئَاتُ مَا عَمِلُوا) – (zalım şəxslərə) **öz xəbis əməllərinin pis cəzası yetişdi.** (وَحَاقَ بِهِمْ مَا كَانُوا بِهِ يَسْتَهْزِؤُنَ) – (Allah-Təalanın peyğəmbərinə və hökmlərinə) **istehza etmələrinin** (cəzası da) **onları əhatə edib** (həlak oldular)**.**

**35)** (وَقَالَ الَّذِينَ اَشْرَكُوا) – **müşriklər dedilər:** (لَوْ شَٓاءَ اللّٰهُ مَا عَبَدْنَا مِنْ دُونِهِ مِنْ شَيْءٍ نَحْنُ وَلَٓا اٰبَٓاؤُنَا) - **əgər Allah-Təala** (bizim iman etməmizi) **istəsəydi, hər halda nə biz özümüz və atalarımız Ondan başqa heç bir şeyə ibadət etməzdik.** (وَلَا حَرَّمْنَا مِنْ دُونِهِ مِنْ شَيْءٍ) - **və ondan izinsiz də heç bir şeyi haram etməzdik.** (Əvvəlki Ənam surəsində özlərinə haram etdikləri dəvə növləri - "bəhirə, saibə, vəsilə və ham" nəzərdə tutulur. Yəni Allah-Təala bizim kafir olmağımızı istəyib, əgər iman etməmizi istəsəydi, biz də imana daxil olardıq. Müşriklərin bu sözlərini cəbriyyə məzhəbində olanlar qəbul edib, onlar da müşriklər kimi belə deyirlər. (Allah-Təala onların cavabında buyurur:) (كَذٰلِكَ فَعَلَ الَّذِينَ مِنْ قَبْلِهِمْ) - (ey Məhəmməd)**, bu müşriklərdən əvvəlkilər də belə edib** (öz xəbis əməllərini Allah-Təalaya isnad etmişdilər)**.** (فَهَلْ عَلَى الرُّسُلِ اِلَّا الْبَلَاغُ الْمُبِينُ) – (onların küfr və şirklərinin cəzası Allah-Təalaya aiddir. Allah-Təala özü onların cəzasını verəcəkdir. Allah-Təalanın) **peyğəmbərlərinin vəzifəsi isə ancaq açıq-aşkar təbliğ edib** (Allahın ehkamını xalqa çatdırmaqdır)**.**

**36)** (وَلَقَدْ بَعَثْنَا فِي كُلِّ اُمَّةٍ رَسُولًا) - (ey Məhəmməd, necə ki səni bu Qüreyş camaatının içindən seçib peyğəmbər göndərdik. Habelə səndən əvvəl də) **hər bir ümmətin içindən peyğəmbər** (seçib) **göndərmişik.** (Sənin Qüreyşin içindən peyğəmbər olmağın təəccüblü bir iş deyildir)**.** (اَنِ اعْبُدُوا اللّٰهَ وَاجْتَنِبُوا الطَّاغُوتَ) – (peyğəmbərlərə əmr etdik ki, xalqa belə deyin: yeganə olan) **Allah-Təalaya ibadət edib tağuta** (şeytana və bütlərə) **itaət etməkdən çəkinib kənar olun.** (فَمِنْهُمْ مَنْ هَدَى اللّٰهُ) – (peyğəmbərlərin ümmətlərindən) **bəzisi** (imana meyil etdiyi üçün) **Allah-Təala da onlara hidayət verib** (imanlarında sabit və bərqərar etdi)**.** (وَمِنْهُمْ مَنْ حَقَّتْ عَلَيْهِ الضَّلَالَةُ) – (o ümmətlərin) **bəzilərinin də** (küfr və inada meyil etdiklərindən) **zəlalətdə qalmaları layiq olub** (o küfr və zəlalət içində ölüb Allah-Təalanın əzabı onlara şamil oldu)**.** (فَسِيرُوا فِي الْاَرْضِ فَانْظُرُوا كَيْفَ كَانَ عَاقِبَةُ الْمُكَذِّبِينَ) – (ey Qüreyş camaatı)**, yer üzündə bir seyr edib** (zalım şəxslərin əsərlərinə baxıb bir fikir verin)**, görün** (peyğəmbərləri) **təkzib edənlərin aqibəti necə oldu?** (Hamısına əzab göndərib həlak etdik. Səmud və Ad cama-

اِنْ تَحْرِصْ عَلٰى هُدٰيهُمْ فَاِنَّ اللّٰهَ لَا يَهْدِي مَنْ يُضِلُّ وَمَا لَهُمْ مِنْ نَاصِرِينَ ﴿٣٧﴾ وَاَقْسَمُوا بِاللّٰهِ جَهْدَ اَيْمَانِهِمْ لَا يَبْعَثُ اللّٰهُ مَنْ يَمُوتُ بَلٰى وَعْدًا عَلَيْهِ حَقًّا وَلٰكِنَّ اَكْثَرَ النَّاسِ لَا يَعْلَمُونَ ﴿٣٨﴾ لِيُبَيِّنَ لَهُمُ الَّذِي يَخْتَلِفُونَ فِيهِ وَلِيَعْلَمَ الَّذِينَ كَفَرُوٓا اَنَّهُمْ كَانُوا كَاذِبِينَ ﴿٣٩﴾ اِنَّمَا قَوْلُنَا لِشَيْءٍ اِذَٓا اَرَدْنَاهُ اَنْ نَقُولَ لَهُ كُنْ فَيَكُونُ ﴿٤٠﴾

---

atının yurdları Qüreyş camaatının yolu üstündə olduğundan Allah-Təala Qüreyş camaatına əmr edir ki, onların diyarından keçəndə baxıb ibrət alsınlar).

**37)** (اِنْ تَحْرِصْ عَلٰى هُدٰيهُمْ) **-** (ey Məhəmməd)**, hərçənd sən** (Qüreyş camaatının) **hidayət tapıb** (imana daxil olmasını) **həddindən çox istəyirsən,** (amma onlar imana daxil olan deyildirlər, bəlkə küfr və zəlalətdə qalmağa layiqdirlər). (فَاِنَّ اللّٰهَ لَا يَهْدِي مَنْ يُضِلُّ) **- həqiqətən, Allah-Təala** (azdırdığı)**, küfr və zəlaləti seçən şəxsləri** (imana) **hidayət etməz.** (وَمَا لَهُمْ مِنْ نَاصِرِينَ) **- onlara kömək edən də olmaz** (ki, onlara Allah-Təalanın əzabından nicat versin).

**38)** (وَاَقْسَمُوا بِاللّٰهِ جَهْدَ اَيْمَانِهِمْ لَا يَبْعَثُ اللّٰهُ مَنْ يَمُوتُ)– (Məkkəli müşriklər) **Allah-Təalaya möhkəm and içib** (dedilər:) **Allah-Təala ölən şəxsi** (qiyamət günündə bir yerə toplamaq üçün) **diriltməz.** (بَلٰى) **-** (ey Məhəmməd)**, xeyr.** (Bu müşriklər yalandan and içib belə deyirlər, bəlkə, Allah-Təala ölənləri yenidən dirildib məhşərdə toplayacaqdır). (وَعْدًا عَلَيْهِ حَقًّا) – (Allah-Təalanın qiyamət günündə ölüləri dirildəcəyi vədi) **haqq olan vəddir,** (onda heç bir xilaf yoxdur). (وَلٰكِنَّ اَكْثَرَ النَّاسِ لَا يَعْلَمُونَ) **- lakin insanların əksəriyyəti** (Allah-Təalanın insanları dirildəcəyini) **bilmir.** (O səbəbdən deyirlər ki, insanın sümükləri çürüyüb torpaq olandan sonra necə dirilə bilər? Amma bundan qafildirlər ki, onları yaratmağa qadir olan Allah-Təala, əlbəttə, diriltməyə də qadir olar).

**39)** (لِيُبَيِّنَ لَهُمُ الَّذِي يَخْتَلِفُونَ فِيهِ) – (əlbəttə, Allah-Təala onları qiyamət günündə diriddər ki, dünyada) **ixtilaf etdikləri şeyləri** (dirilib məhşərdə toplanmağı) **onlara bəyan etsin,** (yəni necə oldu, qiyaməti inkar edirdiniz, indi sizə məlum oldu ki, peyğəmbərlərin dünyada dediyi sözlər haqq imiş?) (وَلِيَعْلَمَ الَّذِينَ كَفَرُوٓا اَنَّهُمْ كَانُوا كَاذِبِينَ) – (bir də onları dirildib ona görə məhşərdə toplayarıq ki, qoy kafirlər qiyamət günündə dirilib toplanmağı) **inkar edənlərin yalançı olduğunu bilsinlər.**

**40)** (اِنَّمَا قَوْلُنَا لِشَيْءٍ اِذَٓا اَرَدْنَاهُ اَنْ نَقُولَ لَهُ كُنْ فَيَكُونُ) – (sizi diriltmək bizdən ötrü müşkül və çətin bir iş deyil)**, halbuki biz bir şeyi** (yaratmaq) **istədikdə,** (heç bir başqa köməyə, ya da başqa bir şeyə ehtiyacımız olmayıb) **ancaq o şeyə** (əmr edib) **deyərik: "Var ol", o şey də dərhal olar."** (Sizi yenidən yaratmaq da belədir. Bizdən ötrü mümkün olub heç bir şey bizim qüdrətimizə mane ola bilməz. Bu ayənin məzmunu Allah-Təalanın insanları yaratmasının Onun üçün asan olduğunu bizə bildirməkdən ötrü məsəldir, yoxsa Allah-Təala ilə

وَالَّذِينَ هَاجَرُوا فِي اللّٰهِ مِنْ بَعْدِ مَا ظُلِمُوا لَنُبَوِّئَنَّهُمْ فِي الدُّنْيَا حَسَنَةً وَلَاَجْرُ الْاٰخِرَةِ اَكْبَرُ لَوْ كَانُوا
يَعْلَمُونَ ﴿٤١﴾ اَلَّذِينَ صَبَرُوا وَعَلٰى رَبِّهِمْ يَتَوَكَّلُونَ ﴿٤٢﴾ وَمَٓا اَرْسَلْنَا مِنْ قَبْلِكَ اِلَّا رِجَالًا نُوحِٓي
اِلَيْهِمْ فَسْـَٔلُوٓا اَهْلَ الذِّكْرِ اِنْ كُنْتُمْ لَا تَعْلَمُونَ ﴿٤٣﴾ بِالْبَيِّنَاتِ وَالزُّبُرِ وَاَنْزَلْنَٓا اِلَيْكَ الذِّكْرَ لِتُبَيِّنَ
لِلنَّاسِ مَا نُزِّلَ اِلَيْهِمْ

---

məxluqat arasında nə “kun”, yəni “var ol” sözü var, nə də ondan başqa bir şey. Allah-Təala öz əzəli iradəsi ilə bir şeyin var olmasını istədikdə, o şey dərhal var olar. Nə sözə, nə də danışmağa ehtiyac yoxdur. Allahı təqdis və təsbih edərik, şanı nə ucadır)**.**

**41)** (وَالَّذِينَ هَاجَرُوا فِي اللّٰهِ مِنْ بَعْدِ مَا ظُلِمُوا) – (möminlər) **o şəxslərdir ki,** (Məkkədə) **zülmə məruz qalandan sonra Allah-Təalanın rizasından ötrü** (vətənlərini tərk edib) **hicrət ediblər,** (möminlərdən bir qrup Məkkədən Həbəşistana hicrət etdilər. Hz. Peyğəmbər Mədinəyə hicrət edəndən sonra onlar da Həbəşistandan Mədinəyə varid oldular), (لَنُبَوِّئَنَّهُمْ فِي الدُّنْيَا حَسَنَةً) **- əlbəttə, biz** (o mühacirləri) **dünyada gözəl bir məqam və mərtəbəyə yerləşdirib,** (Məkkə əhlinə və bütün ərəb tayfalarına qalib edib, onlara böyük dərəcələr, əmirlik və hakimiyyət bəxş edərik. Allah-Təala vədinə sadiq olub, mühacirləri müşriklərə qalib edib böyük məqam və dərəcə sahibi etdi)**.** (وَلَاَجْرُ الْاٰخِرَةِ اَكْبَرُ لَوْ كَانُوا يَعْلَمُونَ) **- dünyada möminlərə böyük dərəcələr bəxş edərik, lakin axirətin savabı, əlbəttə,** (dünya mükafatından) **daha böyükdür.** (Əgər kafir və müşriklər Allah-Təalanın bu zəif möminlərə dünya və axirət mükafatını necə bir yerdə verəcəyini bilsələr, onlar da rəğbət edib islama daxil olarlar, amma cəhalət onları haqdan kənar salıb zəlalət vadisində çaşqın qalıblar)**.**

**42)** (اَلَّذِينَ صَبَرُوا وَعَلٰى رَبِّهِمْ يَتَوَكَّلُونَ) – (mühacirlər) **o şəxslərdir ki,** (müşriklərin hər cür əzabına və Allah-Təalanın hərəmi olan vətənlərindən uzaq qalmalarına) **səbir edib hər bir işlərində Allah-Təalaya təvəkkül edərlər.**

**43-44)** (وَمَٓا اَرْسَلْنَا مِنْ قَبْلِكَ اِلَّا رِجَالًا نُوحِي اِلَيْهِمْ) - (Qüreyş camaatı bir insan peyğəmbərin olmasını inkar etdiklərindən Allah-Təala bu ayədə onlara cavab verib buyurur: “Ey Məhəmməd, bu müşriklər sənin peyğəmbər olmanı insan olduğuna görə inkar edirlər, halbuki) **səndən əvvəlki** (ümmətlərə də) **ancaq özlərinə vəhy etdiyimiz** (insan cinsindən olan) **kişi** (peyğəmbərlərdən) **başqasını göndərmədik.** (فَسْـَٔلُوا اَهْلَ الذِّكْرِ اِنْ كُنْتُمْ لَا تَعْلَمُونَ بِالْبَيِّنَاتِ وَالزُّبُرِ) – **əgər möcüzəni və Allah-Təala tərəfindən gələn kitabla** (bir insanın peyğəmbər olmasını) **bilmirsinizsə, gedin kitab əhlindən** (yəhudilərdən) **soruşun,** (onların ki, elm əhli olduğunu bilirsiniz, qoy sizə desinlər ki, bəşərdən peyğəmbər olar, yoxsa olmaz)**.** (وَاَنْزَلْنَٓا اِلَيْكَ الذِّكْرَ لِتُبَيِّنَ لِلنَّاسِ مَا نُزِّلَ اِلَيْهِمْ) - (ey Məhəmməd)**, bu Quranı sənə nazil etdik ki, Allah-Təalanın onlara nazil etdiyi** (o hikmətləri)

وَلَعَلَّهُمْ يَتَفَكَّرُونَ ﴿٤٤﴾ اَفَاَمِنَ الَّذِينَ مَكَرُوا السَّيِّئَاتِ اَنْ يَخْسِفَ اللّٰهُ بِهِمُ الْاَرْضَ اَوْ يَأْتِيَهُمُ الْعَذَابُ مِنْ حَيْثُ لَا يَشْعُرُونَ ﴿٤٥﴾ اَوْ يَأْخُذَهُمْ فِي تَقَلُّبِهِمْ فَمَا هُمْ بِمُعْجِزِينَ ﴿٤٦﴾ اَوْ يَأْخُذَهُمْ عَلٰى تَخَوُّفٍ فَاِنَّ رَبَّكُمْ لَرَؤُفٌ رَحِيمٌ ﴿٤٧﴾ اَوَلَمْ يَرَوْا اِلٰى مَا خَلَقَ اللّٰهُ مِنْ شَيْءٍ يَتَفَيَّؤُا ظِلَالُهُ عَنِ الْيَمِينِ وَالشَّمَائِلِ سُجَّدًا لِلّٰهِ وَهُمْ دَاخِرُونَ ﴿٤٨﴾

---

**insanlardan ötrü bəyan edəsən.** (وَلَعَلَّهُمْ يَتَفَكَّرُونَ) **- əlbəttə,** (müşriklər də gərək Allah-Təalanın sözlərinə baxıb)**, təfəkkür edib** (haqqa yönəlib, imana daxil olsunlar)**.**

**45)** (اَفَاَمِنَ الَّذِينَ مَكَرُوا السَّيِّئَاتِ اَنْ يَخْسِفَ اللّٰهُ بِهِمُ الْاَرْضَ) – (bəs Hz. Peyğəmbər haqqında) **məkr və hiylələr edən** (Məkkə əhli Allah-Təalanın onları) **yerə gömməyəcəyindən arxayındırlar?** (Necə ki onlardan əvvəlki qövmləri qərq etdi)**.** (اَوْ يَأْتِيَهُمُ الْعَذَابُ مِنْ حَيْثُ لَا يَشْعُرُونَ) **– yoxsa güman etmədikləri yerdən onlara əzab gəlməyəcəyindən** (arxayındırlar?)

**46)** (اَوْ يَأْخُذَهُمْ فِي تَقَلُّبِهِمْ فَمَا هُمْ بِمُعْجِزِينَ) **– ya da səfər edərkən** (məişətlə, sənət və ticarətlə məşğul olarkən Allah-Təalanın) **əzabının onları yaxalayıb** (həlak etməyəcəyindən) **arxayındırlar?**

**47)** (اَوْ يَأْخُذَهُمْ عَلٰى تَخَوُّفٍ) **- yoxsa** (əvvəlki qövmlərin əzabını eşidib) **qorxduqları bir halda** (Allah-Təalanın) **əzabının onları yaxalayıb** (həlak etməyəcəyindən) **arxayındırlar?** (فَاِنَّ رَبَّكُمْ لَرَؤُفٌ رَحِيمٌ) – (bu qeyd olunan vaxtların heç birində Allah-Təalanın əzabının gəlməməsindən arxayın deyilsiniz, amma) **həqiqətən, rəbbiniz Allah-Təala sizə mehriban və rəhm edəndir.** (Sizə tələm-tələsik əzab göndərməz, halbuki əzaba layiqsiniz)**.**

**48)** (اَوَلَمْ يَرَوْا اِلٰى مَا خَلَقَ اللّٰهُ مِنْ شَيْءٍ) **– bəs Allah-Təalanın yaratdığı şeylərə** (kölgəsi olan cismlərə) **baxıb** (fikir vermirlərmi?) (يَتَفَيَّؤُا ظِلَالُهُ عَنِ الْيَمِينِ وَالشَّمَائِلِ) **- kölgələri*** (günəşin yüksəlişi səbəbinə) **sağa və sola əyilib,** (artıb-əskilir)**,** (سُجَّدًا لِلّٰهِ وَهُمْ دَاخِرُونَ) – (o cisimlərin kölgələri zəlil və həqir olduqları halda) **Allah-Təalaya səcdə edərlər.** (Kölgənin səcdə etməsi kölgə sahibi olan cismlərin də Allah-Təalanın qüdrətinə ram olduqlarına işarədir. Kölgə sahibi olan cismlər zəlil və həqir olduqları halda, Allah-Təalaya ya könüllü və ya zorla tabe olub itaət edərlər. (Cismə kölgəsindən yaxın bir şey olmayıb, kölgəsi üzərində ixtiyar sahibi olmayan ağıl sahiblərinin də dünya və axirət işlərində bir şeyə malik olmaları mümkün olmaz)**.**

*(*Qeyd: Bir cismin cənub tərəfini onunla üzbəüz və qarşısında qəbul etdiyimiz zaman məğrib tərəfi sağ, məşriq tərəfi isə sol tərəfi hesab olunur. Günəş məşriqdən doğduqda məğribə, yəni cismin sağ tərəfinə kölgə düşüb yavaş-yavaş əyilər, sonra günəş yüksəldikcə kölgələr də şimala doğru qayıdar, günəş günün ortasında tam səmanın*

وَلِلّٰهِ يَسْجُدُ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِ مِنْ دَآبَّةٍ وَالْمَلٰٓئِكَةُ وَهُمْ لَا يَسْتَكْبِرُونَ ﴿٤٩﴾ يَخَافُونَ رَبَّهُمْ مِنْ فَوْقِهِمْ وَيَفْعَلُونَ مَا يُؤْمَرُونَ ۩ ﴿٥٠﴾ وَقَالَ اللّٰهُ لَا تَتَّخِذُٓوا اِلٰهَيْنِ اثْنَيْنِۚ اِنَّمَا هُوَ اِلٰهٌ وَاحِدٌۚ فَاِيَّايَ فَارْهَبُونِ ﴿٥١﴾ وَلَهُ مَا فِي السَّمٰوَاتِ وَالْاَرْضِ وَلَهُ الدِّينُ وَاصِبًاۜ اَفَغَيْرَ اللّٰهِ تَتَّقُونَ ﴿٥٢﴾ وَمَا بِكُمْ مِنْ نِعْمَةٍ فَمِنَ اللّٰهِ ثُمَّ اِذَا مَسَّكُمُ الضُّرُّ فَاِلَيْهِ تَجْـَٔرُونَۚ ﴿٥٣﴾

---

*ortasına gəldikdə, kölgə də qısalar. Günəş qərbə əyilib qürub etdikcə isə cismin sol, məşriq tərəfində kölgə uzanar. Günəş qürub etdikdə isə kölgə tamamən məhv olar).*

**49)** (وَلِلّٰهِ يَسْجُدُ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِ مِنْ دَآبَّةٍ) - **səmalarda və yerdə hər bir hərəkət edən məxluq** (ya öz ixtiyarlarıyla, ya da məcbur olaraq Allah-Təalaya itaət və) **səcdə edər.** (Allah-Təalanın qüdrət və səltənətindən qurtulub xilas ola bilməzlər. Səcdənin mənası budur)**.** (وَالْمَلٰٓئِكَةُ وَهُمْ لَا يَسْتَكْبِرُونَ) - **mələklər də** (Allah-Təalaya zəlil bəndə olmaqda) **təkəbbür etməyib** (səcdə və itaət edərlər)**.**

**50)** (يَخَافُونَ رَبَّهُمْ مِنْ فَوْقِهِمْ) – (mələklər) **onların üzərində qalib olan rəbləri Allah-Təaladan qorxub** (insanlar kimi Allah-Təalaya asi olmazlar)**.** (وَيَفْعَلُونَ مَا يُؤْمَرُونَ) – (mələklər Allah-Təala tərəfindən) **əmr olunduqları hər bir şeyi** (gecikmədən) **edib** (heç vaxt Allah-Təalanın əmrini tərk etməzlər)**.**

**51)** (وَقَالَ اللّٰهُ لَا تَتَّخِذُٓوا اِلٰهَيْنِ اثْنَيْنِ) - (əvvəlki ayələrdə Allah-Təala yaratdığı bütün məxluqatın ya öz ixtiyarları ilə, ya da məcburi olaraq Ona itaət edib, heç vaxt onun qüdrət və hakimiyyətindən kənar olmadıqlarını bəyan etdi. Bu ayədə isə belə bəyan edir: gərək, Allah-Təalaya şərik qoşmayıb onu vahid, şəriksiz biləsiniz. Ayənin mənası belədir)**. Allah buyurdu:** (özünüzə) **iki məbud** (seçib) **qərar verməyin,** ( اِنَّمَا هُوَ اِلٰهٌ وَاحِدٌ) **- həqiqətən, o,** (sizin məbudunuz) **yeganə olan Allah-Təaladır.** (Ondan başqa, haqq məbud yoxdur)**.** (فَاِيَّايَ فَارْهَبُونِ) – (ey mənim bəndələrim)**, ancaq məndən qorxub,** (mənə şərik qoşmayın)**.**

**52)** (وَلَهُ مَا فِي السَّمٰوَاتِ وَالْاَرْضِ) – (Allah-Təalanın şəriki olmadığından) **səmalarda və yerdə olan şeylərin hamısı Onun olub,** (Allah-Təalanın məxluqu və mülküdür)**.** (وَلَهُ الدِّينُ وَاصِبًا) – (bütün varlığa, həqiqətən, nemət verən Allah-Təala olduğundan itaət və ibadət)**, din də Ondan ötrü** (vacib və lazımdır, nəinki batil olan məbudlara)**,** (اَفَغَيْرَ اللّٰهِ تَتَّقُونَ) – (Allah-Təalanın şəriki olmayıb cəmi məxluqat Ona möhtac olduğu halda) **yenə Allah-Təaladan başqasından qorxursunuz?**

**53)** (وَمَا بِكُمْ مِنْ نِعْمَةٍ فَمِنَ اللّٰهِ) – **sizə gələn hər bir nemət Allah-Təaladandır.** (ثُمَّ اِذَا مَسَّكُمُ الضُّرُّ فَاِلَيْهِ تَجْـَٔرُونَ) – (bu nemətlərdən) **sonra nə zaman sizə** (bir xəstəlik)**, ya da bir bəla və müsibət üz versə, o zaman** (Allah-Təaladan başqa heç bir sığınacaq tapa bilməyib) **Ona dua edib yalvararsınız** (necə ki Allah-Təalanı

ثُمَّ اِذَا كَشَفَ الضُّرَّ عَنْكُمْ اِذَا فَرِيقٌ مِنْكُمْ بِرَبِّهِمْ يُشْرِكُونَ ﴿٥٤﴾ لِيَكْفُرُوا بِمَٓا اٰتَيْنَاهُمْ فَتَمَتَّعُوا فَسَوْفَ
تَعْلَمُونَ ﴿٥٥﴾ وَيَجْعَلُونَ لِمَا لَا يَعْلَمُونَ نَصِيبًا مِمَّا رَزَقْنَاهُمْ تَاللّٰهِ لَتُسْـَٔلُنَّ عَمَّا كُنْتُمْ تَفْتَرُونَ ﴿٥٦﴾

---

inkar edən materialistlərdə müşahidə olunur, şiddətli xəstəlik halında, ya da səhrada və ya dənizdə bir bəlaya düşəndə ixtiyarsız olaraq mübarək Allah sözü xəbis dillərində peyda olub Allah-Təaladan yardım istəyərlər)**.**

**54)** (ثُمَّ اِذَا كَشَفَ الضُّرَّ عَنْكُمْ) – (Allah-Təalanı çağırıb dua edəndən sonra nə zaman Allah-Təala duanızı qəbul edib) **bəla və müsibəti üzərinizdən götürüb** (qəm-qüssənizi yox etsə)**,** (اِذَا فَرِيقٌ مِنْكُمْ بِرَبِّهِمْ يُشْرِكُونَ) **- o vaxt da** (qəfildən) **sizdən bir dəstə öz rəbləri Allah-Təalanı*** (inkar edib) **Ona şərik qərar qoşarlar.**

*(*__Qeyd:__ İnsanlar düçar olduqları bəla və xəstəliyin dəf edilməsini Allah-Təaladan başqa, özgə səbəblərə isnad etdiklərində o səbəbləri Allah-Təalaya şərik qoşmuş olub müşrik olarlar. Məsələn, xəstəliyin sağalmasını, həqiqətən, həkimə, ya da dərmana isnad etmək - hər nə qədər onlar zahirdə səbəb kimi görünsələr də, bu, onları Allah-Təalaya şərik qoşmaqdır. Çünki həkimə ağıl gücünü, dərmanlara isə xəstəliyi sağaltma gücünü verən ancaq Allah-Təaladır. Gərək səbəbləri vasitə sayıb, səbəblərin həqiqi yaradıcısına şükür edilsin. İnsan öz ağlıyla tədbir görüb, bir işin olması üçün səbəblərə riayət etsə də, Allahın qeybdən zühura gətirdiyi bir səbəblə onun gördüyü bütün tədbirlər məhv olub heç bir fayda verməz, Mövlana Cəlaləddin Rumi nə gözəl bəyan edir: Bu səbəbdən qara sevdalıyam, Bu səbəblə Sufiyəm.).*

**55)** (لِيَكْفُرُوا بِمَا اٰتَيْنَاهُمْ) – (Allah-Təala bəla və müsibəti onlardan dəf edəndən sonra) **onlara verdiyimiz nemətə nankorluq etmək üçün** (Allah-Təalaya şərik qoşdular)**,** (فَتَمَتَّعُوا فَسَوْفَ تَعْلَمُونَ) – (ey Allah-Təalaya şərik qoşub, nemətə nankor olanlar, sizdən Allah-Təalaya heç bir zərər gəlməz, bu dünyada) **ləzzət alın.** (Tezliklə) **biləcəksiniz** (ki, öləndən sonra aqibətiniz necə olub, Allah-Təala sizə necə əzab edəcək?)

**56)** (وَيَجْعَلُونَ لِمَا لَا يَعْلَمُونَ نَصِيبًا مِمَّا رَزَقْنَاهُمْ) – (müşriklər) **onlara verdiyimiz ruzidən** (əkin və heyvanatdan həqiqətən məbud olduqlarını) **bilmədikləri** (bütlərdən ötrü də) **pay ayırarlar.** (Onları zənn və güman üzrə məbud bilib xeyir və zərər verən hesab edirdilər. Müşriklər əkin və heyvanlarının bir qismini bütlərdən ötrü nəzir edib deyərdilər: "Filan məhsulumuz yaxşı gəlsə, ya filan heyvanlarımız sağ-salamat doğsa, onların bir hissəsi bütlərin olsun." İşləri düz getsə, nəzir etdikləri məhsulun bir qismini bütlərin qabağına pay qoyardılar, ya da nəzir etdikləri heyvanı kəsib, onu təmtəraqla bütlərin xidmətçilərinə, yoxsullara pay verərdilər. Ağıl sahibi şəxslər Allah-Təalanın mübarək kəlmələrinin mənasını düşünüb, bizim zəmanə əhlinin əməlləri ilə müqayisə edib ibrət alsınlar). (تَاللّٰهِ لَتُسْـَٔلُنَّ عَمَّا كُنْتُمْ تَفْتَرُونَ) **- and olsun Allah-Təalaya,** (camaatın arasında and içmək adət olduğuna görə, Allah-Təala da özünə və digər məxluqata and içir)**, əlbəttə, siz** (müşriklər qiyamət günündə) **etdiyiniz yalan və ifti-**

وَيَجْعَلُونَ لِلّٰهِ الْبَنَاتِ سُبْحَانَهُ وَلَهُمْ مَا يَشْتَهُونَ ﴿٥٧﴾ وَاِذَا بُشِّرَ اَحَدُهُمْ بِالْاُنْثٰى ظَلَّ وَجْهُهُ مُسْوَدًّا
وَهُوَ كَظِيمٌ ﴿٥٨﴾ يَتَوَارٰى مِنَ الْقَوْمِ مِنْ سُوٓءِ مَا بُشِّرَ بِهٖ اَيُمْسِكُهُ عَلٰى هُونٍ اَمْ يَدُسُّهُ فِي التُّرَابِ اَلَا
سَآءَ مَا يَحْكُمُونَ ﴿٥٩﴾ لِلَّذِينَ لَا يُؤْمِنُونَ بِالْاٰخِرَةِ مَثَلُ السَّوْءِ وَلِلّٰهِ الْمَثَلُ الْاَعْلٰى وَهُوَ الْعَزِيزُ الْحَكِيمُ
﴿٦٠﴾ وَلَوْ يُؤَاخِذُ اللّٰهُ النَّاسَ بِظُلْمِهِمْ مَا تَرَكَ عَلَيْهَا مِنْ دَآبَّةٍ وَلٰكِنْ يُؤَخِّرُهُمْ اِلٰٓى اَجَلٍ مُسَمًّى

---

**ralara görə, sorğu-sual olunacaqsınız.** (Hansı ki, o bütləri Allah-Təalaya şərik qoşub deyirdiniz: “Bunlar bu ibadətlərə layiqdirlər.” Bu sözlərinizə görə, Allah-Təala sizi sorğu-sual edib cəza verəcəkdir).

**57)** (وَيَجْعَلُونَ لِلّٰهِ الْبَنَاتِ) – (müşriklər Allah-Təalaya) **qızları isnad edib** (deyirlər: oğul bizim, qız Allah-Təalanındır. (Ərəblərdən bəni-Xüzaə, bir də bəni-Kinanə camaatı deyirdilər ki, mələklər Allah-Təalanın qızlarıdırlar). (سُبْحَانَهُ) - **Allah-Təala** (özünə övlad götürməkdən) **pak və müqəddəsdir,** (Allah-Təalaya nə qız, nə də oğul övlad lazım deyil, bütün məxluqat Allah-Təalanın qulu və kənizidir). (وَلَهُمْ مَا يَشْتَهُونَ) – (Allah-Təala üçün qız seçib, amma özlərindən ötrü) **arzuladıqlarını** (oğlu) **aid edirlər.** (Bu səbəbdən qızları öldürüb oğulları sağ qoyurdular).

**58)** (وَاِذَا بُشِّرَ اَحَدُهُمْ بِالْاُنْثٰى) – (müşriklər qızları Allah-Təala üçün ayırıb qızlara nifrət etdiklərindən müşriklərdən) **hər hansı birinə qızı olduğu müjdəsi verilsə,** (ظَلَّ وَجْهُهُ مُسْوَدًّا وَهُوَ كَظِيمٌ) – (qız xəbərini eşidən kimi arvadına) **qəzəblənib, üzünün rəngi qaralar** (çünki arvadı qız doğubdur).

**59)** (يَتَوَارٰى مِنَ الْقَوْمِ مِنْ سُوٓءِ مَا بُشِّرَ بِهٖ) – (müşriklərdən qızı olan şəxs) **camaatdan qaçıb, gizlənib ona verilən** (qız) **müjdəsinin pisliyindən ötrü** (camaatın arasına çıxmaz ki, ona məzəmmət və töhmət edib deməsinlər ki, sənin qızın olub). (اَيُمْسِكُهُ عَلٰى هُونٍ) – (öz-özünə təzə doğulan qızı haqda düşünər, **görəsən, o qızı zillət içində saxlasın,** (اَمْ يَدُسُّهُ فِي التُّرَابِ) - **yoxsa** (o qızı diri-diri) **torpağa gömüb** (həlak etsin). (اَلَا سَآءَ مَا يَحْكُمُونَ) – **xəbərdar ol** (ey Məhəmməd, müşriklərin öz qızları ilə etdiyi rəftar belədir), **nə pis hökm edib** (özlərinə oğul, bizə istəmədikləri qızı isnad edirlər, bu nə pis bölgüdür).

**60)** (لِلَّذِينَ لَا يُؤْمِنُونَ بِالْاٰخِرَةِ مَثَلُ السَّوْءِ) - **pis və xəbis sifətlər axirətə iman gətirməyən** (müşriklərdən) **ötrüdür,** (oğlu istəyib, qızı istəməyib öldürürlər), (وَلِلّٰهِ الْمَثَلُ الْاَعْلٰى) - **uca sifətlər Allah-Təalaya məxsusdur.** (Aləmlərə və övlada möhtac olmayıb, məxluqata xas sifətlərindən pak və müqəddəsdir). (وَهُوَ الْعَزِيزُ الْحَكِيمُ) - **Allah-Təala cəmi məxluqata qalib olub hikmət üzrə** (əməl edər).

**61)** (وَلَوْ يُؤَاخِذُ اللّٰهُ النَّاسَ بِظُلْمِهِمْ مَا تَرَكَ عَلَيْهَا مِنْ دَآبَّةٍ) - **əgər Allah-Təala öz etdikləri zülm səbəbilə insana əzab edib** (cəzalandırsa, hər halda əzab göndərib hamısını həlak edib) **yer üzündə heç bir hərəkət edən canlını sağ qoymaz.** (وَلٰكِنْ يُؤَخِّرُهُمْ اِلٰٓى اَجَلٍ مُسَمًّى) - **lakin** (Allah-Təala zülmləri səbəbinə onları dünyada

فَاِذَا جَآءَ اَجَلُهُمْ لَا يَسْتَأْخِرُونَ سَاعَةً وَلَا يَسْتَقْدِمُونَ ﴿٦١﴾ وَيَجْعَلُونَ لِلّٰهِ مَا يَكْرَهُونَ وَتَصِفُ اَلْسِنَتُهُمُ الْكَذِبَ اَنَّ لَهُمُ الْحُسْنٰىۜ لَا جَرَمَ اَنَّ لَهُمُ النَّارَ وَاَنَّهُمْ مُفْرَطُونَ ﴿٦٢﴾ تَاللّٰهِ لَقَدْ اَرْسَلْنَآ اِلٰٓى اُمَمٍ مِنْ قَبْلِكَ فَزَيَّنَ لَهُمُ الشَّيْطَانُ اَعْمَالَهُمْ فَهُوَ وَلِيُّهُمُ الْيَوْمَ وَلَهُمْ عَذَابٌ اَلِيمٌ ﴿٦٣﴾ وَمَآ اَنْزَلْنَا عَلَيْكَ الْكِتَابَ اِلَّا لِتُبَيِّنَ لَهُمُ الَّذِي اخْتَلَفُوا فِيهِۙ وَهُدًى وَرَحْمَةً لِقَوْمٍ يُؤْمِنُونَ ﴿٦٤﴾ وَاللّٰهُ اَنْزَلَ مِنَ السَّمَآءِ مَآءً فَاَحْيَا بِهِ الْاَرْضَ بَعْدَ مَوْتِهَاۜ اِنَّ فِي ذٰلِكَ لَاٰيَةً لِقَوْمٍ يَسْمَعُونَ ﴿٦٥﴾

---

həlak etməyib) **müəyyən olunan vaxta qədər təxirə salar.** (Öldükdən sonra Allah-Təala onlara əzab edəcəkdir). (فَاِذَا جَآءَ اَجَلُهُمْ لَا يَسْتَأْخِرُونَ سَاعَةً وَلَا يَسْتَقْدِمُونَ) **Müəyyən olunan vaxtları gəlib** (öldükdə), **nə bir saat o vaxtdan geri qala bilərlər, nə də bir saat irəli keçə bilərlər.**

**62)** (وَيَجْعَلُونَ لِلّٰهِ مَا يَكْرَهُونَ) **- özlərinin istəməyib xoşlanmadıqları şeyi** (qızları) **Allah-Təalaya isnad edirlər.** (وَتَصِفُ اَلْسِنَتُهُمُ الْكَذِبَ اَنَّ لَهُمُ الْحُسْنٰى) – (qızları Allah-Təalaya isnad etməkdə) **dilləri də yalan söyləyər: Allah-Təalanın gözəl** (cənnəti) **onlardan ötrüdür.** (لَا جَرَمَ اَنَّ لَهُمُ النَّارَ وَاَنَّهُمْ مُفْرَطُونَ) **- halbuki şübhəsiz ki,** (müşriklərdən) **ötrü cəhənnəm odu olub** (cəhənnəmə daxil olub) **orada yaddan çıxıb** (həmişəlik qalacaqlar).

**63)** (تَاللّٰهِ لَقَدْ اَرْسَلْنَآ اِلٰٓى اُمَمٍ مِنْ قَبْلِكَ) - (ey Məhəmməd)**, and olsun Allah-Təalaya,** (Allah-Təala öz-özünə and içir), **həqiqətən, biz səndən əvvəlki ümmətlərə də** (peyğəmbərlər) **göndərdik.** (فَزَيَّنَ لَهُمُ الشَّيْطَانُ اَعْمَالَهُمْ) – (peyğəmbərlərə tabe olmayıb), **şeytan** (xəbis nəfsi-əmmarə) **onlara öz** (küfr və şirk) **əməllərini gözəl göstərib,** (Allah-Təalanın sözlərini tərk edib şeytana tabe oldular). (فَهُوَ وَلِيُّهُمُ الْيَوْمَ) **onların** (bu dünyadakı) **vəlisi və köməyi şeytan olub,** (şeytana itaət edib Allah-Təaladan uzaq oldular). (وَلَهُمْ عَذَابٌ اَلِيمٌ) **- onlardan ötrü** (axirətdə) **şiddətli əzab vardır.**

**64)** (وَمَا اَنْزَلْنَا عَلَيْكَ الْكِتَابَ اِلَّا لِتُبَيِّنَ لَهُمُ الَّذِي اخْتَلَفُوا فِيهِ) - (ey Məhəmməd), **biz bu kitabı** (Quranı) **sənə ancaq ixtilaf etdikləri şeyi** (qiyamət gününü xalqa) **bəyan edəsən deyə göndərdik,** (Qüreyşli müşriklərdən bəzisi qiyaməti inkar edib bəzisi qəbul edirdilər, qəbul edənlərdən biri də Əbdülmüttəlib idi). (وَهُدًى وَرَحْمَةً لِقَوْمٍ يُؤْمِنُونَ) – (bir də Allah-Təalaya) **iman gətirən camaata hidayət və rəhmət olmaqdan ötrü** (Quranı sənə nazil etdik). **Sənə ancaq Quranın hökmünü bəyan etmək lazımdır. Möminlər hidayət tapıb, kafir və müşriklər zəlalətdə qalsalar da, sənə onlardan heç bir zərər gəlməz.**

**65)** (وَاللّٰهُ اَنْزَلَ مِنَ السَّمَاءِ مَاءً فَاَحْيَا بِهِ الْاَرْضَ بَعْدَ مَوْتِهَا) **- Allah-Təala** (sizdən ötrü) **səmadan su göndərib** (o suyun səbəbinə) **yer öləndən sonra ona həyat verib** (yer üzü yaşıllaşıb gözəlləşər). (اِنَّ فِي ذٰلِكَ لَاٰيَةً لِقَوْمٍ يَسْمَعُونَ)**- həqiqətən, bu** (yağışın gəlib, yeri öləndən sonra diriltməsində) **Allah-Təalanın ayələrini eşidib**

وَاِنَّ لَكُمْ فِي الْاَنْعَامِ لَعِبْرَةًۜ نُسْقِيكُمْ مِمَّا فِي بُطُونِهٖ مِنْ بَيْنِ فَرْثٍ وَدَمٍ لَبَنًا خَالِصًا سَٓائِغًا لِلشَّارِبِينَ
﴿٦٦﴾ وَمِنْ ثَمَرَاتِ النَّخِيلِ وَالْاَعْنَابِ تَتَّخِذُونَ مِنْهُ سَكَرًا وَرِزْقًا حَسَنًاۜ اِنَّ فِي ذٰلِكَ لَاٰيَةً لِقَوْمٍ يَعْقِلُونَ
﴿٦٧﴾ وَاَوْحٰى رَبُّكَ اِلَى النَّحْلِ اَنِ اتَّخِذِي مِنَ الْجِبَالِ بُيُوتًا وَمِنَ الشَّجَرِ وَمِمَّا يَعْرِشُونَۙ ﴿٦٨﴾

---

(onda təfəkkür edən) **camaatdan ötrü** (Allah-Təalanın tövhid və qüdrətinə dair) **dəlil və sübut vardır.**

**66)** (وَاِنَّ لَكُمْ فِي الْاَنْعَامِ لَعِبْرَةً) **- əlbəttə, sizdən ötrü heyvanlarda** (dəvə, öküz, qoyun, keçi) **ibrət vardır.** (Əgər onlara fikir versəniz, bizim mükəmməl qüdrətimizə agah olarsınız)**.** (نُسْقِيكُمْ مِمَّا فِي بُطُونِهٖ مِنْ بَيْنِ فَرْثٍ وَدَمٍ لَبَنًا خَالِصًا) – (o heyvanların) **qarnında olan ifrazatla qanının arasında təmiz südü sizə içirdərik.** (Nə qana, nə də ifrazata qarışmayan təmiz südü sizdən ötrü yaradıram. Bəs bundan ibrət almazsınızmı?) (سَٓائِغًا لِلشَّارِبِينَ) – (o süd) **içənlərin** (boğazından) **asan keçər.** (Ən şərəfli məxluq olan insanın ilk qidası süd olduğundan bütün nemətlərin ən yaxşısı süddür)**.**

**67)** (وَمِنْ ثَمَرَاتِ النَّخِيلِ وَالْاَعْنَابِ) **- sizə xurma və üzüm ağaclarının meyvələrindən** (ruzi verdik)**.** (تَتَّخِذُونَ مِنْهُ سَكَرًا) - (xurma və üzümdən) **məst edən şeyi** (yəni şərab) **düzəldirsiniz.** (وَرِزْقًا حَسَنًا) – (bir də şərabdan başqa üzüm və xurmadan sirkə və şirə kimi) **gözəl ruzilər** (hazırlayırsınız)**.** (Bu ayə Məkkədə nazil olub şərab barəsində nazil olan ilk ayədir. Şərabın haram olmasına işarə edir. Çünki Allah-Təala şərabı yox, xurma və üzümdən əmələ gələn şeyləri gözəl ruzi adlandırır. Mədinədə nazil olan Maidə surəsində şərab açıq şəkildə haram olundu)**.** (اِنَّ فِي ذٰلِكَ لَاٰيَةً لِقَوْمٍ يَعْقِلُونَ) – (Allah-Təalanın bu nemətlərində) **ağılla düşünən camaatdan ötrü** (Allah-Təalanın tövhid və qüdrətinə) **dəlil və sübutlar var.**

**68)** (وَاَوْحٰى رَبُّكَ اِلَى النَّحْلِ) **-** (Allah-Təala bu ayədə heyvanlara verdiyi elmdən bəhs edir. O heyvanların içində bədəni zəif, şüuru kamil olan bal arısıdır. Allah-Təalanın bu zəif heyvanın elmi haqqında Hz. Peyğəmbərə xitab etməkdə məqsədi elmin şərəfini insanlara bildirməkdir, yəni bu zəif heyvan öz elminə və bu elmi ilə insanlara verdiyi faydaya görə siz insanlar arasında əziz və dəyərli olubdur. Bu səbəbdən siz insanlar da elmin şərəfini dərk edib özünüzü cəhalət uçurumundan xilas edin. Allah-Təala buyurur: (ey Məhəmməd)**, rəbbin Allah-Təala bal arısına vəhy etdi,** (Allah-Təala bu heyvana verdiyi qabiliyyəti vəhy təbiri ilə ifadə edir)**.** (اَنِ اتَّخِذِي مِنَ الْجِبَالِ بُيُوتًا وَمِنَ الشَّجَرِ وَمِمَّا يَعْرِشُونَ) – (Allah-Təala vəhy göndərib bal arısına dedi ki,) **dağlarda, ağaclarda və** (insanların sizdən ötrü) **ucaltdığı çardaqlarda özünə ev tut.**

ثُمَّ كُلِي مِنْ كُلِّ الثَّمَرَاتِ فَاسْلُكِي سُبُلَ رَبِّكِ ذُلُلًا يَخْرُجُ مِنْ بُطُونِهَا شَرَابٌ مُخْتَلِفٌ اَلْوَانُهُ فِيهِ شِفَاۤءٌ لِلنَّاسِ اِنَّ فِي ذٰلِكَ لَاٰيَةً لِقَوْمٍ يَتَفَكَّرُونَ ﴿٦٩﴾ وَاللّٰهُ خَلَقَكُمْ ثُمَّ يَتَوَفّٰيكُمْ وَمِنْكُمْ مَنْ يُرَدُّ اِلٰى اَرْذَلِ الْعُمُرِ

---

**69)** (ثُمَّ كُلِي مِنْ كُلِّ الثَّمَرَاتِ) – (evləri düzəldəndən sonra) **hər bir meyvədən** (və çiçəklərdən) **ye.** (فَاسْلُكِي سُبُلَ رَبِّكِ ذُلُلًا) – (meyvələri yeyəndən sonra bal əmələ gətirmək üçün rəbbin Allah-Təalanın sənə təlim, ilham etdiyi yollarla rahat (asan) get, (ki, bal hasil olsun)**.** (يَخْرُجُ مِنْ بُطُونِهَا شَرَابٌ مُخْتَلِفٌ اَلْوَانُهُ) **-** (ey Məhəmməd, biz bal arısına bunu təlim edəndən sonra meyvələrdən, çiçəklərdən yeyib Allah-Təalanın izniylə) **onun qarnından müxtəlif rənglərdə bal çıxar.** (Balın bəzisi ağ, bəzisi sarı, bəzisi qaramtıl olur)**.** (فِيهِ شِفَاۤءٌ لِلنَّاسِ) – (balda) **insanlardan ötrü** (xəstəliklərdən) **şəfa vardır.** (Rütubət və bəlğəmdən meydana gələn xəstəliklərdə bal şəfadır və heç kim rütubət və bəlğəmdən uzaq olmadığından bütün insanlara balı şəfa kimi buyurdu)**.** (اِنَّ فِي ذٰلِكَ لَاٰيَةً لِقَوْمٍ يَتَفَكَّرُونَ) **- həqiqətən, bu** (bal* arısının təbiətində və əməlində Allah-Təalanın ayələrini) **düşünən bir camaatdan ötrü** (Allah-Təalanın tövhid və qüdrətinə dair) **dəlil və sübut vardır.**

*(*Qeyd:* *Həqiqətən, bal arısının əməlinə fikir verəndə belə zəif heyvandan belə fərasət və qabiliyyətlə meydana gələn əməl insanı mat və çaşqın edir. Allah-Təala onların hər bir dəstəsinə özlərindən cüssəcə böyük birini rəhbər qoyub, hər bir dəstə meydana gələndə içlərindən biri əmir olub xüsusi rəng ilə digərlərindən seçilər. Elə ki, şanı tikməyə başladılar, Allah-Təalanın onlara bəxş etdiyi qabiliyyətlə elə bir şanı tikərlər ki, heç mühəndislər o cür şanı tikməyə qabil olmazlar. Şanılarını kənarları bir-birinə bərabər altıbucaq şəklində elə tikərlər ki, aralarında boş yer qalmasın. Əgər başqa şəkildə, dördbucaq, beşbucaq şəklində tiksəydilər, hər halda onların arası boş qalıb, çox bal toplaya bilməzdilər. O bir nəfər əmirin hökmü ilə meyvə və çiçəklərdən topladıqları ilə mumdan şanı hazırlayandan sonra o əmir şanıların hər birinə bir toxum qoyar, o toxumlar bir neçə gündən sonra kiçik ağ qurd olar. Toxumlar dirilən kimi gətirib həmin şanıların divarlarına bir qədər bal sürtüb o şanının ağzını mumla möhkəm örtüb bərkidərlər. Bir neçə gündən sonra şanının daxilində olan ağ qurdlar arı surətinə girib şanının ağzını öz qüvvələriylə açıb hamısı bir dəfədə uçub ordan çıxarlar. Arı saxlayanlar bunun vaxtını bilib, onlardan ötrü ayrı pətək təyin edib oradan çıxan kimi o pətəkdə onları sakin edərlər. Bal toplayıb gətirən vaxt əmirin hökmü ilə qoyulan qapıçılar bal gətirənlərə baxarlar. Əgər onlardan bir nəfər qoxumuş və murdar şeylərin üstünə qonmuş olsa, o saat onu öldürüb onun cəsədini kənara atarlar. Bu heyvanın təəccüblü işləri çoxdur. Zoologiya elmini bilənlər onun dəqiq əməllərindən yaxşı xəbərdardırlar).*

**70)** (وَاللّٰهُ خَلَقَكُمْ ثُمَّ يَتَوَفّٰيكُمْ) **- Allah-Təala siz insanı** (yoxdan) **yaratdı, ondan sonra** (sizdən ötrü təyin etdiyi vaxt gələndə) **sizi öldürər.** (وَمِنْكُمْ مَنْ يُرَدُّ اِلٰى اَرْذَلِ الْعُمُرِ) **- siz** (insanların) **bəzisi ömrün ən rəzil çağına** (qocalığa) **çatdırılar.**

لِكَيْ لَا يَعْلَمَ بَعْدَ عِلْمٍ شَيْـًٔا ۗ اِنَّ اللّٰهَ عَلِيمٌ قَدِيرٌ ﴿٧٠﴾ وَاللّٰهُ فَضَّلَ بَعْضَكُمْ عَلٰى بَعْضٍ فِي الرِّزْقِۚ
فَمَا الَّذِينَ فُضِّلُوا بِرَٓادِّي رِزْقِهِمْ عَلٰى مَا مَلَكَتْ اَيْمَانُهُمْ فَهُمْ فِيهِ سَوَٓاءٌ ۜ اَفَبِنِعْمَةِ اللّٰهِ يَجْحَدُونَ
﴿٧١﴾ وَاللّٰهُ جَعَلَ لَكُمْ مِنْ اَنْفُسِكُمْ اَزْوَاجًا وَجَعَلَ لَكُمْ مِنْ اَزْوَاجِكُمْ بَنِينَ وَحَفَدَةً وَرَزَقَكُمْ مِنَ
الطَّيِّبَاتِ اَفَبِالْبَاطِلِ يُؤْمِنُونَ وَبِنِعْمَتِ اللّٰهِ هُمْ يَكْفُرُونَ ۙ ﴿٧٢﴾ وَيَعْبُدُونَ مِنْ دُونِ اللّٰهِ مَا لَا يَمْلِكُ
لَهُمْ رِزْقًا مِنَ السَّمٰوَاتِ وَالْاَرْضِ شَيْـًٔا وَلَا يَسْتَطِيعُونَ ۚ ﴿٧٣﴾

---

(Bir şəxs 60 yaşını keçəndən sonra qocalıq çağına qədəm qoyub gücü yavaş-yavaş zəifləyər. Yaşı artdıqca ağlı da azalar. Çox az hallarda qocalanda ağlı yerində qalar). (لِكَيْ لَا يَعْلَمَ بَعْدَ عِلْمٍ شَيْـًٔا)– (Allah-Təala insanı ömrünün sonuna, qocalığa çatdırar ki, uşaqlıq halına qayıdıb), (vaxtilə) **bildiyi şeyləri unudub** (cahil olsun). (Yəni Allah-Təala insanı həyatdan ölümə, elmdən cəhalətə qaytarmağa qadirdir). (اِنَّ اللّٰهَ عَلِيمٌ قَدِيرٌ) **- həqiqətən, Allah-Təala məxluqatının əhvalına,** (kimin ömrünü uzun, kimin ömrünü qısa etməyə agah və qadirdir)**.**

**71)** (وَاللّٰهُ فَضَّلَ بَعْضَكُمْ عَلٰى بَعْضٍ فِي الرِّزْقِ) **- Allah-Təala sizlərdən bəzisini bəzilərinə ruzidə üstün edib** (artıq veribdir)**.** (فَمَا الَّذِينَ فُضِّلُوا بِرَٓادِّي رِزْقِهِمْ عَلٰى مَا مَلَكَتْ اَيْمَانُهُمْ) – (Allah-Təalanın ruzidə) **üstün etdiyi şəxslər öz ruzilərini qulam və kənizlərinə verməzlər ki, onlarla** (yemək və libasda) **bərabər olsunlar.** (فَهُمْ فِيهِ سَوَٓاءٌ) **- halbuki onların özləri,** (qulam və kənizləri Allah-Təalanın verdiyi ruzidə) **bərabərdirlər.** (Qulam və kənizlərin ruzidə, məişətdə özlərinə şərik olmasına razı olmurlar, bəs Allah-Təalanın yaratdığı məxluqatı Ona necə şərik qoşmağa razı olurlar?) (اَفَبِنِعْمَةِ اللّٰهِ يَجْحَدُونَ) – **bəs Allah-Təalanın nemətini inkar edib** (ona şərik qoşub, ondan başqasına ibadət edirlər? Bu, ağıllıların əməli deyil)**.**

**72)** (وَاللّٰهُ جَعَلَ لَكُمْ مِنْ اَنْفُسِكُمْ اَزْوَاجًا) **- Allah-Təala sizin üçün özünüzdən arvadlar yaratdı.** (Hər cins öz cinsinə meyil etdiyindən Allah-Təala hər bir cinsin dişisini öz cinsindən yaratdı)**.** (وَجَعَلَ لَكُمْ مِنْ اَزْوَاجِكُمْ بَنِينَ وَحَفَدَةً) **- arvadlarınızdan sizin üçün oğullar və nəvələr əmələ gətirdi.** (Oğulları, nəvələri sizə Allah-Təala bəxş edib, necə olur ki, oğulları özünüzə götürüb, qızları Allah-Təalaya verirsiniz? Halbuki hamısını Allah-Təala yaradıbdır)**.** (وَرَزَقَكُمْ مِنَ الطَّيِّبَاتِ) – **və Allah-Təala pak və pakizə** (meyvələrdən və heyvanların ləzzətli ətlərindən, yaxşı, dadlı sulardan) **sizə ruzi verdi.** (Yenə siz bu nemətlərin hamısını unudub nankorluq edirsiniz)**.** (اَفَبِالْبَاطِلِ يُؤْمِنُونَ) **-** (ey Məhəmməd, bu müşriklər Allah-Təalanı qoyub) **batil** (bütlərə) **iman gətirib** (onlardan bərəkət və şəfaət ümid edirlər?) (وَبِنِعْمَتِ اللّٰهِ هُمْ يَكْفُرُونَ)**- Allah-Təalanın nemətlərinə** (şükür etməyin əvəzinə) **inkar edirlər?**

**73)** (وَيَعْبُدُونَ مِنْ دُونِ اللّٰهِ مَا لَا يَمْلِكُ لَهُمْ رِزْقًا مِنَ السَّمٰوَاتِ وَالْاَرْضِ شَيْـًٔا وَلَا يَسْتَطِيعُونَ) – (ey Məhəmməd, bu müşriklər) **Allah-Təaladan başqa** (o bütlərə) **ibadət**

فَلَا تَضْرِبُوا لِلّٰهِ الْاَمْثَالَ ۜ اِنَّ اللّٰهَ يَعْلَمُ وَاَنْتُمْ لَا تَعْلَمُونَ ﴿٧٤﴾ ضَرَبَ اللّٰهُ مَثَلًا عَبْدًا مَمْلُوكًا لَا يَقْدِرُ عَلٰى شَيْءٍ وَمَنْ رَزَقْنَاهُ مِنَّا رِزْقًا حَسَنًا فَهُوَ يُنْفِقُ مِنْهُ سِرًّا وَجَهْرًاۜ هَلْ يَسْتَوُنَ ۜ اَلْحَمْدُ لِلّٰهِ ۜ بَلْ اَكْثَرُهُمْ لَا يَعْلَمُونَ ﴿٧٥﴾ وَضَرَبَ اللّٰهُ مَثَلًا رَجُلَيْنِ اَحَدُهُمَٓا اَبْكَمُ لَا يَقْدِرُ عَلٰى شَيْءٍ وَهُوَ كَلٌّ عَلٰى مَوْلٰيهُ ۙ

---

**edirlər ki, o bütlər onlardan ötrü səmalardan və yerdən heç bir ruziyə malik olmayıb qüdrət sahibi də deyillər?** (O bütlərin qüdrəti yoxdur ki, onlardan ötrü səmadan yağış göndərib yerdən cürbəcür meyvələr yetişdirsinlər. Bəs ağılı olan kəs belə şeylərə itaət və ibadət edərmi?)

**74)** (فَلَا تَضْرِبُوا لِلّٰهِ الْاَمْثَالَ) – **Allah-Təalaya** (öz yaratdığı məxluqu) **misal çəkib oxşatmayın.** (Xaliqi məxluqa, qadiri acizə oxşatmaq olarmı?) (اِنَّ اللّٰهَ يَعْلَمُ وَاَنْتُمْ لَا تَعْلَمُونَ) **- həqiqətən, Allah-Təala** (sizə və əməllərinizə) **agahdır,** (və əməlinizə müvafiq sizə qarşılıq verər)**. Amma siz** (Allah-Təalaya və Onun əməllərinin həqiqətinə) **agah ola bilməzsiniz.** (Belə olan halda siz necə Allah-Təaladan ötrü məsəllər çəkib, onu bütlərə oxşadıb, bütləri ona şərik qoşursunuz?)

**75)** (ضَرَبَ اللّٰهُ مَثَلًا عَبْدًا مَمْلُوكًا لَا يَقْدِرُ عَلٰى شَيْءٍ) - (siz Allah-Təaladan ötrü məsəl çəkə bilməzsiniz, amma Allah-Təala sizdən ötrü məsəl çəkər. Siz müşriklər bütləri Allah-Təalaya şərik qoşduğunuza görə) **Allah-Təala** (ağasından izinsiz) **heç bir şeyə gücü çatmayan, başqasının köləsi olan bir qulu məsəl çəkir,** (وَمَنْ رَزَقْنَاهُ مِنَّا رِزْقًا حَسَنًا) – **və bir də o şəxsi** (misal çəkir ki, azad olub) **öz tərəfimizdən ona gözəl ruzilər vermiş olaq,** (öz ixtiyarıyla o ruzilərdən istədiyi kimi istifadə etsin)**.** (فَهُوَ يُنْفِقُ مِنْهُ سِرًّا وَجَهْرًا) – (o ruzidən Allah-Təala yolunda) **gizlin və aşkar ehsan edər.** (هَلْ يَسْتَوُنَ) – (bəs o qulamla bu azad olan şəxs) **eyni və bərabər olarmı?** (Siz bu iki şəxsi bir-birinə bərabər tutmayıb deyirsiniz ki, qulam azad şəxsə bərabər olmaz. Bəs necə olur ki, cansız şeyləri Allah-Təalaya şərik qoşub, adlarını məbud qoyub onlara ibadət edirsiniz? Ar olsun sizə!) (اَلْحَمْدُ لِلّٰهِ) **- həmd-səna Allah-Təalaya məxsusdur.** (Və həmd-səna olunmağa layiqdır. İnsanları yoxdan yaradıb nemət verən Allah-Təaladır. Və bu səbəbdən O, həmd-səna edilməyə layiqdir, nəinki sizin bu cansız bütləriniz, fikir verib cəhaləti kənara qoyun)**.** (بَلْ اَكْثَرُهُمْ لَا يَعْلَمُونَ)- (ey Məhəmməd)**, bəlkə,** (bu müşriklərin) **çoxu cəhalətdə qalıb** (həmd-sənanın ancaq Allah-Təalaya layiq olduğuna agah deyillər)**.**

**76)** (وَضَرَبَ اللّٰهُ مَثَلًا رَجُلَيْنِ) **-** (Allah-Təala ona şərik qoşduqları üçün müşriklərə ikinci misalı nümunə verib buyurur:) **Allah-Təala** (siz müşriklərdən ötrü) **iki kişinin məsəlini verir:** (baxın görək, o iki kişinin hansına yaxşı demək olar və hansını sevib itaət etmək olar? Onları bir-birinə bərabər və eyni saymaq olar, yoxsa yox? O vaxt sizə məlum olar ki, sizin sitayiş etdiyiniz bütləri Allah-Təalaya bərabər saymaq olmaz.) (اَحَدُهُمَا اَبْكَمُ لَا يَقْدِرُ عَلٰى شَيْءٍ) – (o iki kişidən) **biri** (anadangəlmə lal olub**, bir şey** (danışmağa) **qadir deyil,** (وَهُوَ كَلٌّ عَلٰى مَوْلٰيهُ)

اَيْنَمَا يُوَجِّهْهُ لَا يَأْتِ بِخَيْرٍۜ هَلْ يَسْتَوِي هُوَۙ وَمَنْ يَأْمُرُ بِالْعَدْلِۙ وَهُوَ عَلٰى صِرَاطٍ مُسْتَقٖيمٍ ﴿٧٦﴾ وَلِلّٰهِ
غَيْبُ السَّمٰوَاتِ وَالْاَرْضِۜ وَمَٓا اَمْرُ السَّاعَةِ اِلَّا كَلَمْحِ الْبَصَرِ اَوْ هُوَ اَقْرَبُۜ اِنَّ اللّٰهَ عَلٰى كُلِّ شَيْءٍ قَدٖيرٌ
﴿٧٧﴾ وَاللّٰهُ اَخْرَجَكُمْ مِنْ بُطُونِ اُمَّهَاتِكُمْ لَا تَعْلَمُونَ شَيْـًٔاۙ وَجَعَلَ لَكُمُ السَّمْعَ وَالْاَبْصَارَ وَالْاَفْـِٔدَةَۙ

---

**- bu kişi** (bu halda) **öz ağasına bir yükdür.** (اَيْنَمَا يُوَجِّهْهُ لَا يَأْتِ بِخَيْرٍ) – (ağası bu lal kişini bir işdən ötrü) **hara göndərsə, heç bir xeyir və mənfəət götürə bilməz.** (هَلْ يَسْتَوِي هُوَ وَمَنْ يَأْمُرُ بِالْعَدْلِ وَهُوَ عَلٰى صِرَاطٍ مُسْتَقٖيمٍ) **- bu** (lal olan şəxs xalqa) **ədaləti əmr edən, özü doğru yolda olan şəxslə eyni və bərabər olarmı?** (Əlbəttə, bərabər olmaz, bəs necə olur ki, xeyir və zərər verməyən bütləri xalqa lütf və mərhəməti ilə sonsuz nemətlər verən Allah-Təalaya* bərabər sayıb, ona şərik qoşub ibadət edirsiniz?)

*(*Qeyd: Bu ayələrin hökmü ancaq o dövrdə yaşayan şəxslərə məxsus deyildir. Bəlkə, hər bir dövrdə, gərək, ayələrin məzmununu yadda saxlayıb, Allah-Təalaya şərik qoşulan məbudları tərk etmək lazımdır. Əgər bizim bu zəmanəmizdə diqqət və insafla müsəlmanların əməllərinə baxılsa, hər halda onların əksəriyyətini cahiliyyə dövründə yaşayan şəxslərə oxşar görüb, onlar kimi xeyir və zərər verməyən məzarlardan, ya da cansız əşyalardan yardım istəyib, bəlkə də, onlara qul kimi üzü üstə səcdə edib, yalvarıb-yaxarmaqla onlardan mədəd istəyirlər. Bəs bu cahiliyyə, bütpərəstlik əməli deyilmi? Zahirdə müsəlman olub, əslində, islamdan uzaq olan bu şəxslər şəxsi mənfəətlərindən ötrü islam dünyasının hər bir bölgəsində türbə tikib - burada vəli yatır, bunda bütün xəstəliklərə şəfa var, nə arzu etsən, yerinə yetər kimi sözlərlə avam camaatı qoyun kimi aldadıb, cəhalət iztirabına salıb çaşbaş edirlər. İslam ümməti arasında nə böyük bidətlər meydana gəlibdir. Bundan artıq bidət və zülmət nə ola bilər? Əgər onların nəfsani arzularına zidd olan Qurani-Şərifin ayələrini onlara oxusan, hər halda bunu oxuyanı zındıqlıqla günahlandırıb, ancaq özlərini Quran əhli sayırlar. Əksər müsəlmanların əməllərinin Qurana zidd olması cahilliklərinə dəlil deyilmi?)*

**77)** (وَلِلّٰهِ غَيْبُ السَّمٰوَاتِ وَالْاَرْضِ) **- səmalarda və yerdə** (məxluqdan) **qeyb olan şeylərin** (elmi) **Allah-Təalaya məxsusdur.** (Allah-Təaladan başqa heç kim onlardan agah ola bilməz. O elmlərdən biri də qiyamət gününə agah olmaqdır)**.** (وَمَٓا اَمْرُ السَّاعَةِ اِلَّا كَلَمْحِ الْبَصَرِ اَوْ هُوَ اَقْرَبُ) – (qiyamət gününü siz çox uzaq sayırsınız, amma) **qiyamətin qopması** (sürətli olub Allah-Təala yanında) **bir göz qırpımında, ya da ondan yaxındır.** (O günün vaqe olmasında heç bir şəkk və şübhə yoxdur. Əlbəttə, vaqe olacaqdır)**.** (اِنَّ اللّٰهَ عَلٰى كُلِّ شَيْءٍ قَدٖيرٌ)**- həqiqətən, Allah-Təala hər bir şeyə** (və qiyamət günündə insanları dirildib, onlardan haqq-hesab çəkməyə qadirdir)**.**

**78)** (وَاللّٰهُ اَخْرَجَكُمْ مِنْ بُطُونِ اُمَّهَاتِكُمْ لَا تَعْلَمُونَ شَيْـًٔا) – **heç bir şey bilməyib** (elm və mərifətdən uzaq olduğunuz) **halda, Allah-Təala sizi ananızın bətnindən çıxartdı.** (وَجَعَلَ لَكُمُ السَّمْعَ وَالْاَبْصَارَ وَالْاَفْـِٔدَةَ) **- sizə* qulaq, göz, qəlb verdi** (ki,

لَعَلَّكُمْ تَشْكُرُونَ ﴿٧٨﴾ اَلَمْ يَرَوْا اِلَى الطَّيْرِ مُسَخَّرَاتٍ فِي جَوِّ السَّمَآءِ مَا يُمْسِكُهُنَّ اِلَّا اللّٰهُ اِنَّ فِي ذٰلِكَ
لَاٰيَاتٍ لِقَوْمٍ يُؤْمِنُونَ ﴿٧٩﴾ وَاللّٰهُ جَعَلَ لَكُمْ مِنْ بُيُوتِكُمْ سَكَنًا وَجَعَلَ لَكُمْ مِنْ جُلُودِ الْاَنْعَامِ بُيُوتًا
تَسْتَخِفُّونَهَا يَوْمَ ظَعْنِكُمْ وَيَوْمَ اِقَامَتِكُمْ وَمِنْ اَصْوَافِهَا وَاَوْبَارِهَا وَاَشْعَارِهَا اَثَاثًا وَمَتَاعًا اِلٰى حِينٍ ﴿٨٠﴾

---

bunların səbəbinə cəhalət və nadanlıqdan elm və mərifətə çıxasınız). (لَعَلَّكُمْ تَشْكُرُونَ) **- əlbəttə, (gərək Allah-Təalanın bu nemətlərinə) şükür edib (verdiyi nemətləri, gərək, haqq yolda istifadə edəsiniz).**

*(*Qeyd: Allah-Təalanın bu orqanları insana bəxş etməsindəki ilk məqsədi elm öyrənmələridir. Necə ki ayədən məlum olur, bu orqanları elmdən başqa bir yerdə işlətmək Allah-Təalanın nemətinə nankor olmaqdır. Müsəlmanlar gör nə qədər Qurani-Şərifin ayələrindən bixəbər qalıblar ki, cəhalət və nadanlığı özlərinə şüar edib elm nuru ilə aydınlanmayıb, cəhalətdən aralarında hər cür fəsad və qətl hadisəsi meydana gəlir. Qurani-Şərifin ədəbi ilə ədəblənməyib Qurana açıq-aşkar müxalif olan sözləri özlərinə elm və ədəb sayıb, onlara etiqad edib, özlərini alim sayıb, xalqa rəhbərlik iddiasında olurlar. Avam camaatı cəhalətə salıb, onları da özləri kimi xəbis əmələ vadar edirlər. Ya avam camaatın cəhalətdə qalmasını özlərinə faydalı sayıb, ilahi ehkamın həqiqətini onlara bəyan etmirlər. Ya da özləri, həqiqətən, cahil olub alim cildinə giriblər. Belə vaxtda cahil cahilə necə hidayət edib elm və mərifətə, kamala qovuşdura bilər? Quranın tərk edilməsi və xalqın arasında ölülərdən ötrü oxumaqdan başqa bir şeyə lazım olmaması müsəlmanları belə fəlakət gününə salıb, hər kəsə əl açıb başqalarından ianə xahiş edirlər).*

**79)** (اَلَمْ يَرَوْا اِلَى الطَّيْرِ مُسَخَّرَاتٍ فِي جَوِّ السَّمَاءِ) **-** (ey Məhəmməd, bəs bu insanlar) **səmanın boşluğunda** (uçaraq Allah-Təalanın qüdrətinə) **ram olan quşlara baxmırlar?** (مَا يُمْسِكُهُنَّ اِلَّا اللّٰهُ) – (o quşlar uçan vaxt) **Allah-Təaladan başqa onları heç kim** (havada) **saxlaya bilməz,** (ancaq Allah öz kamil qüdrəti ilə buna qadirdir). (اِنَّ فِي ذٰلِكَ لَاٰيَاتٍ لِقَوْمٍ يُؤْمِنُونَ) **- həqiqətən, bu** (quşların havada uçmasında) **Allah-Təalaya iman gətirən camaatdan ötrü** (Allah-Təalanın tövhid və qüdrətinə) **dəlil və sübutlar vardır.**

**80)** (وَاللّٰهُ جَعَلَ لَكُمْ مِنْ بُيُوتِكُمْ سَكَنًا) **- Allah-Təala** (şəhər və kəndlərdəki daş və ya palçıqdan olan) **evlərinizi** (sakit və rahat olasınız deyə) **sizə məskən etdi.** (Daşı, palçığı və sair şeyləri, onlarla ev tikmə elmini, güc və qabiliyyətini özü yaratdıb sizə bəxş etdiyindən Allah-Təala belə buyurur). (وَجَعَلَ لَكُمْ مِنْ جُلُودِ الْاَنْعَامِ بُيُوتًا) – (Allah-Təala səhrada yaşayan) **sizdən ötrü heyvanların** (dəvə, öküz, qoyun, keçi) **dərisindən evlər** (çadırlar) **düzəltdi,** (تَسْتَخِفُّونَهَا يَوْمَ ظَعْنِكُمْ وَيَوْمَ اِقَامَتِكُمْ) **– həm köç günündə və bir yerdə qaldığınız gündə sizin üçün** (daşıması) **asan, yüngül olan** (heyvan dərilərindən sizdən ötrü evlər düzəltdi). (وَمِنْ اَصْوَافِهَا) **- heyvanların yunlarından,** (وَاَوْبَارِهَا) **tiftiklərindən** (وَاَشْعَارِهَا)**- və tüklərindən** (اَثَاثًا وَمَتَاعًا اِلٰى حِينٍ) **- bu** (qeyd olunan) **şeylərdən müəyyən** (ölüm) **vaxta kimi istifadə edəcəyiniz əşyalar** (paltar və s.) **verdi.**

وَاللّٰهُ جَعَلَ لَكُمْ مِمَّا خَلَقَ ظِلَالًا وَجَعَلَ لَكُمْ مِنَ الْجِبَالِ اَكْنَانًا وَجَعَلَ لَكُمْ سَرَابِيلَ تَقِيكُمُ الْحَرَّ
وَسَرَابِيلَ تَقِيكُمْ بَأْسَكُمْ كَذٰلِكَ يُتِمُّ نِعْمَتَهُ عَلَيْكُمْ لَعَلَّكُمْ تُسْلِمُونَ ﴿٨١﴾ فَاِنْ تَوَلَّوْا فَاِنَّمَا عَلَيْكَ الْبَلَاغُ
الْمُبِينُ ﴿٨٢﴾ يَعْرِفُونَ نِعْمَتَ اللّٰهِ ثُمَّ يُنْكِرُونَهَا وَاَكْثَرُهُمُ الْكَافِرُونَ ﴿٨٣﴾ وَيَوْمَ نَبْعَثُ مِنْ كُلِّ اُمَّةٍ
شَهِيدًا ثُمَّ لَا يُؤْذَنُ لِلَّذِينَ كَفَرُوا وَلَا هُمْ يُسْتَعْتَبُونَ ﴿٨٤﴾

---

**81)** (وَاللّٰهُ جَعَلَ لَكُمْ مِمَّا خَلَقَ ظِلَالًا) **- Allah-Təala sizdən ötrü yaratdığı şeylərdən kölgələr meydana gətirdi** (ki, günün isti vaxtında o kölgə ilə istilikdən qorunasınız)**.** (وَجَعَلَ لَكُمْ مِنَ الْجِبَالِ اَكْنَانًا) – (Allah-Təala) **sizin üçün dağlardan sığınacaqlar yaratdı** (ki, ehtiyac anında o yerlərdə məskun olasınız)**.** (وَجَعَلَ لَكُمْ سَرَابِيلَ تَقِيكُمُ الْحَرَّ) **- və** (heyvanların yunundan və ya yerin otundan, soyuqdan) **və istidən sizi qoruyan köynəklər** (və digər libaslar) **yaratdı.** (وَسَرَابِيلَ تَقِيكُمْ بَأْسَكُمْ) **- və yenə sizdən ötrü zirehli geyimlər yaratdı** (ki, savaşda sizi düşmənin zərərindən qoruyub saxlasın. Bu şeylərin materialları Allah-Təala tərəfindən yaradıldığı üçün və bu əşyalar Allah-Təalanın insanlara bəxş etdiyi ağılla düzəldiyi üçün Allah-Təala o şeyləri özünə isnad etdi)**.** (كَذٰلِكَ يُتِمُّ نِعْمَتَهُ عَلَيْكُمْ لَعَلَّكُمْ تُسْلِمُونَ) **- Allah-Təala nemətini sizə belə tamamlayıb verir ki, gərək siz də** (Allah-Təalanın nemətlərinə baxıb ona iman edib) **itaət edəsiniz.**

**82)** (فَاِنْ تَوَلَّوْا فَاِنَّمَا عَلَيْكَ الْبَلَاغُ الْمُبِينُ) **-** (ey Məhəmməd, əgər xalq sənə qulaq asmayıb) **səndən üz döndərsə,** (sənə heç bir zərəri yoxdur)**, həqiqətən sənə lazım olan şey açıq-aşkar təbliğ edib** (Allah-Təalanın sözlərini xalqa çatdırmaqdır. Xalq qulaq asır, ya asmır, ondan sənə bir təqsir və məzəmmət olmaz)**.**

**83)** (يَعْرِفُونَ نِعْمَتَ اللّٰهِ ثُمَّ يُنْكِرُونَهَا) **-** (ey Məhəmməd, müşriklər) **Allah-Təalanın nemətini tanıyıb** (iqrar edirlər ki, hər bir nemət Allah-Təaladandır. Amma onlara deyiləndə ki, Allah-Təalaya şərik qoşmayın, bu sözü eşidəndən sonra nemətləri) **inkar edib** (deyirlər: doğrudur, bu nemətlər Allah-Təaladandır. Amma bizim bütlərimizin şəfaətiylə bu nemətlər hasil olub. Bütlərə ibadət etməkdən necə kənar qalaq?) (وَاَكْثَرُهُمُ الْكَافِرُونَ) **-** (ey Məhəmməd, müşriklərin) **əksəriyyəti inkar edən kafirlərdir.**

**84)** (وَيَوْمَ نَبْعَثُ مِنْ كُلِّ اُمَّةٍ شَهِيدًا) **-** (ey Məhəmməd)**, qiyamət günü hər bir ümmətdən ötrü** (öz peyğəmbərlərini) **şahid gətirib** (hazır edərik ki, onların Allah-Təalanın nemətlərini inkar edib kafir olduqlarına şəhadət etsinlər)**.** (ثُمَّ لَا يُؤْذَنُ لِلَّذِينَ كَفَرُوا) – (peyğəmbərlər şəhadət edəndən) **sonra kafirlərin** (əzabdan xilas olmaq üçün üzrxahlıq edib bəhanə gətirmələrinə) **izin verilməz.** (وَلَا هُمْ يُسْتَعْتَبُونَ) **- və üzr diləmələri də istənməz.** (Yəni onlara deyilməz ki, danışın, bəlkə, Allah-Təalanı özünüzdən razı salasınız. Axirət aləmi təklif yeri olmadığına görə, kafirlərin üzr istəyib danışmağa izinləri olmaz)**.**

وَاِذَا رَاَ الَّذِينَ ظَلَمُوا الْعَذَابَ فَلَا يُخَفَّفُ عَنْهُمْ وَلَا هُمْ يُنْظَرُونَ ﴿٨٥﴾ وَاِذَا رَاَ الَّذِينَ اَشْرَكُوا
شُرَكَٓاءَهُمْ قَالُوا رَبَّنَا هٰٓؤُلَٓاءِ شُرَكَٓاؤُنَا الَّذِينَ كُنَّا نَدْعُوا مِنْ دُونِكَۚ فَاَلْقَوْا اِلَيْهِمُ الْقَوْلَ اِنَّكُمْ لَكَاذِبُونَۚ
﴿٨٦﴾ وَاَلْقَوْا اِلَى اللّٰهِ يَوْمَئِذٍ السَّلَمَ وَضَلَّ عَنْهُمْ مَا كَانُوا يَفْتَرُونَ ﴿٨٧﴾ اَلَّذِينَ كَفَرُوا وَصَدُّوا عَنْ
سَبِيلِ اللّٰهِ زِدْنَاهُمْ عَذَابًا فَوْقَ الْعَذَابِ بِمَا كَانُوا يُفْسِدُونَ ﴿٨٨﴾ وَيَوْمَ نَبْعَثُ فِي كُلِّ اُمَّةٍ شَهِيدًا
عَلَيْهِمْ مِنْ اَنْفُسِهِمْ وَجِئْنَا بِكَ شَهِيدًا عَلٰى هٰٓؤُلَٓاءِۜ وَنَزَّلْنَا عَلَيْكَ الْكِتَابَ تِبْيَانًا لِكُلِّ شَيْءٍ

---

**85)** (وَاِذَا رَاَ الَّذِينَ ظَلَمُوا الْعَذَابَ) – (Allah-Təalanın məxluqatına və özlərinə küfr və şirklə) **zülm edənlər** (qiyamət gününün) **əzabını gördükdə,** (فَلَا يُخَفَّفُ عَنْهُمْ وَلَا هُمْ يُنْظَرُونَ) – (əzab dərhal onları yaxalayıb)**, nə əzabları yüngülləşdirilməz, nə də** (əzabdan) **onlara möhlət verilməz.**

**86)** (وَاِذَا رَاَ الَّذِينَ اَشْرَكُوا شُرَكَٓاءَهُمْ) – (qiyamət günündə müşriklər) **Allah-Təalaya şərik qoşduqları bütlərini gördükdə,** (Allah-Təala müşriklərə dəlil göstərməkdən ötrü qiyamət günündə onların bütlərini də oraya gətizdirər), (قَالُوا رَبَّنَا هٰٓؤُلَٓاءِ شُرَكَٓاؤُنَا الَّذِينَ كُنَّا نَدْعُوا مِنْ دُونِكَ) – (müşriklər bütlərini görən kimi) **deyərlər: "Ey bizim rəbbimiz,** (bizim sənə şərik qoşub) **səndən başqa ibadət etdiyimiz şəriklərimiz** (bütlərimiz) **bunlardır.** (Bunlar bizi aldadıb özlərinə ibadət etməyə çağırdılar)**."** (فَاَلْقَوْا اِلَيْهِمُ الْقَوْلَ اِنَّكُمْ لَكَاذِبُونَ) – (bütlər müşriklərə) **cavab verib deyər: "Həqiqətən, siz** (bu sözünüzdə) **yalançısınız",** (heç vaxt sizi aldadıb özümüzə ibadət etməyə dəvət etməmişik. Bütlər hərçənd cansızdırlar, amma ruh sahibi olan mələklər və peyğəmbərlər onların əvəzinə bu cavabı verərlər)**.**

**87)** (وَاَلْقَوْا اِلَى اللّٰهِ يَوْمَئِذٍ السَّلَمَ) – (müşriklərin sözləri batil oldu)**, ogünkü gündə** (qiyamət günü) **Allah-Təalanın hökmünə və əmrinə itaət edib** (bütləri onlara bir fayda verməz)**.** (وَضَلَّ عَنْهُمْ مَا كَانُوا يَفْتَرُونَ) – (o günkü gündə) **iftira edib** (Allah-Təalaya şərik qoşduqları bütlər batil olub)**, onlardan qeyb olub gedər.**

**88)** (اَلَّذِينَ كَفَرُوا وَصَدُّوا عَنْ سَبِيلِ اللّٰهِ) **- kafir olub, başqalarını da Allah-Təala yoluna daxil olub** (iman gətirməsinə) **mane olanlar,** (زِدْنَاهُمْ عَذَابًا فَوْقَ الْعَذَابِ بِمَا كَانُوا يُفْسِدُونَ) - (fəsad törədib xalqın imana daxil olmasına mane olduqlarına görə)**, onların əzablarının üstünə bir əzab da əlavə edərik.**

**89)** (وَيَوْمَ نَبْعَثُ فِي كُلِّ اُمَّةٍ شَهِيدًا عَلَيْهِمْ مِنْ اَنْفُسِهِمْ)**- qiyamət günü hər bir ümmətin içində özlərindən** (olan peyğəmbəri onlara) **şahid gətirərik.** (وَجِئْنَا بِكَ شَهِيدًا عَلٰى هٰٓؤُلَٓاءِ) - (ey Məhəmməd)**, səni də** (öz ümmətinə) **şahid gətirərik.** (Belə ki, onların yaxşı və pis əməllərinə şəhadət edəsən, necə ki özgə peyğəmbərlər şəhadət edər)**.** (وَنَزَّلْنَا عَلَيْكَ الْكِتَابَ تِبْيَانًا لِكُلِّ شَيْءٍ) **-** (ey Məhəmməd, xalqın din və dünya) **işlərinin hamısının bəyanı* bu Quranda olduğu halda, bu Quranı sənə**

وَهُدًى وَرَحْمَةً وَبُشْرٰى لِلْمُسْلِمِينَ ۟ ﴿٨٩﴾ اِنَّ اللّٰهَ يَأْمُرُ بِالْعَدْلِ وَالْاِحْسَانِ وَاِيتَآئِ ذِي الْقُرْبٰى
وَيَنْهٰى عَنِ الْفَحْشَآءِ وَالْمُنْكَرِ وَالْبَغْيِ يَعِظُكُمْ لَعَلَّكُمْ تَذَكَّرُونَ ﴿٩٠﴾

---

**nazil etdik.** (وَهُدًى وَرَحْمَةً وَبُشْرٰى لِلْمُسْلِمِينَ) – (Qurani-Şərif zəlalətə düşənlərdən ötrü) **hidayət və rəhmət,** (iman gətirib təsdiq edən) **müsəlmanlardan ötrü** (Allah-Təalanın əzabından nicat tapmağa) **müjdədir.**

*(*Qeyd: İslam ümmətinin din və dünya işləri iki şeylə tamam olar: biri Qurani-Şərifdə qeyd olunan ehkamla, ikincisi hörmətli peyğəmbərimizin ləl-cəvahirat kimi olan sözləriylə. Qurani-Şərifdə Allah-Təala biz müsəlmanlara əmr edir: - "Mənim Peyğəmbərim sizə nə hökm etsə, onu qəbul edib əməl edin". Bu ayənin məzmunundan aydın olur ki, Qurani-Şərifdə din və dünya işlərinin hamısının izahı vardır. Çünki Allah-Təala Hz. Peyğəmbəri xalqa öz ağlı ilə hökm etməklə vəzifələndirəndən sonra Hz. Peyğəmbərin o hökmləri Allah-Təalanın Qurani-Şərifdəki hökmləri kimi olar. Məsələn, sultan öz vəzirini mütləq ixtiyar sahibi edib, hökm və qanun verməyi də onun ixtiyarına verəndən sonra vəzir nə hökm versə, o hökm sultanın hökmüdür və ona tabe olmaq vacibdir. Qurani-Şərif və Hz. Peyğəmbərin uca fərmanları onun səhabələrindən bizə bir-bir nəql olunub gəlib çatıbdır. Necə ki Hz. Peyğəmbərin sözlərini Allah-Təalanın fərmanıyla qəbul edib onlara əməl etməyi özümüzə vacib saymışıqsa, habelə səhabələrdən nəql olunan sözləri də Hz. Peyğəmbərin fərmanıyla Allah-Təaladan bizə gələn hökm kimi qəbul etməliyik. Hz. Peyğəmbər buyurub: "Mənim səhabələrim göydəki ulduzlar kimidirlər, hansına tabe olsanız, hidayət taparsınız" (Müslüm, Fədailus-Səhabə, 207)).*

**90)** (اِنَّ اللّٰهَ يَأْمُرُ بِالْعَدْلِ وَالْاِحْسَانِ) **-** (bütün islam ümməti bu ayənin məzmununu gərək özlərindən əziz sayıb həmişə gözlərinin qabağında, yaddaşlarında saxlayıb, gərək, onun ali məzmununa əməl etməyi vacib və lazım bilsinlər. Allah buyurur:) **həqiqətən, Allah-Təala müsəlmanlara əmr edir ki,** (qəbih olan zülm sifətini tərk edib, bir-birilərilə) **ədalət və yaxşılıq üzrə rəftar etsinlər.** (وَاِيتَآئِ ذِي الْقُرْبٰى) **- və** (əmr etdi ki:) **qohum-əqrəbalarınıza** (yaxşılıq edib onlarla gözəl şəkildə rəftar edəsiniz, əlinizdə olan ruzilərdən (yoxsul) qohum-əqrəbalarınıza (və sair yoxsullara) verib (yardım edəsiniz)**.** (وَيَنْهٰى عَنِ الْفَحْشَآءِ وَالْمُنْكَرِ وَالْبَغْيِ) – (Allah-Təala) **pis əməlləri** (məsələn, zinanı, homoseksuallığı, ağıla, insafa) **zidd şeyləri və** (təkəbbürlənib xalqa) **zülm etməyi sənə qadağan edir.** (يَعِظُكُمْ لَعَلَّكُمْ تَذَكَّرُونَ) **- Allah-Təala sizə nəsihət edir ki, bəlkə,* ibrət alıb** (Allah-Təalanın öyüd-nəsihətini qəbul edib, pis əməlləri tərk edib gözəl işlər görəsiniz)**.**

*(*Qeyd: Heyif! müsəlmanlar belə bir ayənin uca məzmununu unudub özgə millətlərin arasında zülm və insafsızlığı ilə məşhur olduğundan, onların əməlləri özgə millətlərin nəzərində islamın əsası kimi görünür. Bir insan hansı din və məzhəbdən olsa da, gərək, özgə dinlərin əslinə insaf nəzəriylə baxıb o millətin arasında adət olan bəd əməllərə baxmasın. İslamın əsası Qurani-Şərifin ehkamına, bir də Hz. Peyğəm-*

وَاَوْفُوا بِعَهْدِ اللّٰهِ اِذَا عَاهَدْتُمْ وَلَا تَنْقُضُوا الْاَيْمَانَ بَعْدَ تَوْكِيدِهَا وَقَدْ جَعَلْتُمُ اللّٰهَ عَلَيْكُمْ كَفِيلًاۜ اِنَّ اللّٰهَ
يَعْلَمُ مَا تَفْعَلُونَ ﴿٩١﴾ وَلَا تَكُونُوا كَالَّتِي نَقَضَتْ غَزْلَهَا مِنْ بَعْدِ قُوَّةٍ اَنْكَاثًاۜ تَتَّخِذُونَ اَيْمَانَكُمْ دَخَلًا
بَيْنَكُمْ اَنْ تَكُونَ اُمَّةٌ هِيَ اَرْبٰى مِنْ اُمَّةٍۜ اِنَّمَا يَبْلُوكُمُ اللّٰهُ بِهٖۜ

---

*bərin verdiyi qanunlara söykənir. Bu iki qanunun hansı birində var ki, zülm edib, qəbih əməllərə qoşulmaq yaxşı şeydir, hansı ağılsız belə söz deyə bilər, xüsusən, o şəxs ki peyğəmbərlik iddiası etsin, qəbih olan şeyləri necə əmr edər? Əgər iddiası haqq olmasa da, gərək, iddiasını sabit etməkdən ötrü yaxşı və gözəl şeyləri əmr etsin, halbuki Qurani-Şərifin sayəsində bizim uca peyğəmbərimizin haqlılığının sübutu səmada olan günəş kimidir. Heç vaxt günəşin üzünü qara palçıqla örtmək olmaz. Əgər başqa dinlərdən olan müdrik şəxslər öz dinlərinə olan məhəbbəti bir kənara qoyub zehinləri hər bir şeydən saf olan zamanda Qurani-Şərifin ayələrinə diqqətlə baxıb fikir versələr, hər halda Qurani-Şərifin insanlığın din və dünya işlərinə kifayət edən bir kitab olduğunu görərlər. Bəs insanlıq sifətlərinə sahib olmaqdan ötrü bircə bu ayə kifayət etməzmi? Halbuki bundan başqa, Qurani-Şərifin digər ayələrində də, bəzilərində açıq-aşkar, bəzilərində də işarə ilə gözəl əxlaq əmr edilib, xəbis əməllər qadağan edilir. Bu ayə hər ikisini ehtiva edən bir ayədir. İlk Əməvi xəlifəsi Müaviyə ibn Əbu Süfyanın zamanında minbərlərdə xütbə əsnasında əmirəl-möminin Hz. Əliyə lənət oxumaq adəti illərlə davam edib bu qəbih adət xalqın arasında yayılıb, yerləşmişdi. Əməvi xəlifələrindən Ömər ibnül-Əbdüləziz hakimiyyətə gəldikdə bu zahid xəlifə bu çirkin adəti xalqın arasından yığışdırmaq istədi. Xalqın bu qəbih adəti tərk edəcəyinə ümidsiz olduğundan xətiblərə əmr etdi ki, bütün islam ölkələrində Hz. Əliyə lənət yerinə bu ayə oxunsun. Qəbih şeyi gözəl şeylə bundan yaxşı dəyişdirmək olmaz, bunda incə və dəqiq mənalar vardır. Ağıl sahiblərinin ayənin məzmununa diqqət etməsi tövsiyə olunur).*

**91)** (وَاَوْفُوا بِعَهْدِ اللّٰهِ اِذَا عَاهَدْتُمْ) – (and içib bir şeyə) **əhd etdikdə, Allah-Təalanın əhdinə vəfalı olun.** (وَلَا تَنْقُضُوا الْاَيْمَانَ بَعْدَ تَوْكِيدِهَا) - **andlarınızı möhkəm edəndən sonra pozmayın.** (وَقَدْ جَعَلْتُمُ اللّٰهَ عَلَيْكُمْ كَفِيلًا) – (niyə bu andınızı pozursunuz?)**, halbuki Allah-Təalanı özünüzə** (şahid və) **zamin edibsiniz.** (اِنَّ اللّٰهَ يَعْلَمُ مَا تَفْعَلُونَ) **Allah nə etdiklərinizdən agahdir.**

**92)** (وَلَا تَكُونُوا كَالَّتِي نَقَضَتْ غَزْلَهَا مِنْ بَعْدِ قُوَّةٍ اَنْكَاثًا)– (əhdinizi və andınızı pozmaqda yundan, ya da tükdən) **bir şeyi möhkəm toxuduqdan sonra onu açıb dağıdan** (qadın) **kimi olmayın.** (Allah-Təala bu qadını islama daxil olub, Hz. Peyğəmbərə beyət edib, əhd edəndən sonra andı pozanlardan ötrü məsəl çəkir)**.** (تَتَّخِذُونَ اَيْمَانَكُمْ دَخَلًا بَيْنَكُمْ) **- öz aranızdakı andlarınızı hiylə və xəyanətə çevirirsiniz,** (اَنْ تَكُونَ اُمَّةٌ هِيَ اَرْبٰى مِنْ اُمَّةٍ) **-** (ki, əhd edib and içdiyiniz) **camaatdan başqa bir camaat** (qüvvətdə və malda) **çox olarkən** (əvvəlki camaatın əhdini pozub qüvvətli camaata tərəf gedib onlarla əhd bağlayasınız. Hz. Peyğəmbəri və möminləri tərk edib müşriklərə tabe olasınız. Belə işlərdən kənar olun)**.** (اِنَّمَا يَبْلُوكُمُ اللّٰهُ بِهٖ) **- həqiqətən, Allah-Təala sizi** (o qüvvətli və çox mal sahibi olan camaatla) **imtahan edir.** (Görsün ki, siz əhdi pozub onlara meyil edirsiniz,

وَلَيُبَيِّنَنَّ لَكُمْ يَوْمَ الْقِيٰمَةِ مَا كُنْتُمْ فِيهِ تَخْتَلِفُونَ ﴿٩٢﴾ وَلَوْ شَٓاءَ اللّٰهُ لَجَعَلَكُمْ اُمَّةً وَاحِدَةً وَلٰكِنْ يُضِلُّ
مَنْ يَشَٓاءُ وَيَهْدِي مَنْ يَشَٓاءُ وَلَتُسْـَٔلُنَّ عَمَّا كُنْتُمْ تَعْمَلُونَ ﴿٩٣﴾ وَلَا تَتَّخِذُوٓا اَيْمَانَكُمْ دَخَلًا بَيْنَكُمْ
فَتَزِلَّ قَدَمٌ بَعْدَ ثُبُوتِهَا وَتَذُوقُوا السُّٓوءَ بِمَا صَدَدْتُمْ عَنْ سَبِيلِ اللّٰهِ وَلَكُمْ عَذَابٌ عَظِيمٌ ﴿٩٤﴾ وَلَا
تَشْتَرُوا بِعَهْدِ اللّٰهِ ثَمَنًا قَلِيلًا اِنَّمَا عِنْدَ اللّٰهِ هُوَ خَيْرٌ لَكُمْ اِنْ كُنْتُمْ تَعْلَمُونَ ﴿٩٥﴾ مَا عِنْدَكُمْ يَنْفَدُ وَمَا
عِنْدَ اللّٰهِ بَاقٍ

---

yoxsa yox?) (وَلَيُبَيِّنَنَّ لَكُمْ يَوْمَ الْقِيٰمَةِ مَا كُنْتُمْ فِيهِ تَخْتَلِفُونَ)- **əlbəttə, qiyamət günündə haqqında ixtilaf etdiyiniz şeyin haqq olduğunu** (islamın haqq olduğunu) **Allah-Təala sizə bəyan edəcəkdir.** (Lakin siz möhkəm durmayıb əhdi və andı pozursunuz)**.**

**93)** (وَلَوْ شَٓاءَ اللّٰهُ لَجَعَلَكُمْ اُمَّةً وَاحِدَةً) **- əgər Allah-Təala istəsəydi, sizin hamınızı** (zorla toplayıb islama daxil edər)**, bir ümmət edərdi.** (Amma sizi azad yaratdığından sizi məcbur etmədi)**.** (وَلٰكِنْ يُضِلُّ مَنْ يَشَٓاءُ) – **lakin** (Allah-Təala öz hikməti ilə) **istədiyini** (öz ixtiyarıyla küfr və zəlalətə daxil olan şəxsi) **zəlalətdə qoyar,** (وَيَهْدِي مَنْ يَشَٓاءُ) **- və istədiyini** (öz ixtiyarıyla imana meyil edən şəxsi) **hidayətdə sabit edər,** (وَلَتُسْـَٔلُنَّ عَمَّا كُنْتُمْ تَعْمَلُونَ) **- əlbəttə,** (qiyamət günündə dünyada) **etdiklərinizdən sorğu-sual olunacaqsınız.**

**94)** (وَلَا تَتَّخِذُوٓا اَيْمَانَكُمْ دَخَلًا بَيْنَكُمْ) **-** (bu ayədə yenidən təkrarla təkid etməkdən ötrü islama daxil olub and içəndən sonra andı pozmağı qadağan edir. Buyurur:) **öz aranızda andlarınızı hiylə və xəyanətə çevirməyin,** (فَتَزِلَّ قَدَمٌ بَعْدَ ثُبُوتِهَا) **- o zaman qədəmləriniz** (islamda) **möhkəm olandan sonra sürüşüb** (islamın aşkar olan yolundan kənar olarsınız)**.** (وَتَذُوقُوا السُّٓوءَ بِمَا صَدَدْتُمْ عَنْ سَبِيلِ اللّٰهِ) – **və Allah-Təalanın** (islam) **yolundan** (dönüb əhdi pozub, başqalarına da mane olub) **döndərdiyinizə görə** (Allahın) **əzabını dadarsınız.** (وَلَكُمْ عَذَابٌ عَظِيمٌ) – (dünya əzabından başqa, sizdən ötrü axirətdə) **böyük əzab vardır.**

**95)** (وَلَا تَشْتَرُوا بِعَهْدِ اللّٰهِ ثَمَنًا قَلِيلًا) – (ey imana daxil olanlar)**, Allah-Təala ilə olan əhdinizi bir az** (dünya malı) **qarşılığında satmayın.** (Qüreyş camaatı yoxsul müsəlmanlara vəd edirdilər ki, gəlin dininizdən keçib Məhəmmədi inkar edin. Sizə filan qədər məbləğ verərik. Bu ayədə onlara belə əməli qadağan edir)**.** (اِنَّمَا عِنْدَ اللّٰهِ هُوَ خَيْرٌ لَكُمْ اِنْ كُنْتُمْ تَعْلَمُونَ)**- həqiqətən, əgər** (dünya ilə axirətin fərqinə və axirət əcrinin dünya mükafatından artıq olduğuna) **agah olsanız, Allah-Təala yanında olan** (əcr və savab) **sizin üçün dünya malından yaxşıdır,** (dünyanın fani olması, axirətin əbədi olması onların arasındakı fərqi göstərməyə kifayət edər)**.**

**96)** (مَا عِنْدَكُمْ يَنْفَدُ وَمَا عِنْدَ اللّٰهِ بَاقٍ) **- sizin yanınızdakı** (dünya malı fani olub) **tükənər, amma Allah-Təalanın yanında olan** (rəhmət xəzinələri) **əbədidir.**

وَلَنَجْزِيَنَّ الَّذِينَ صَبَرُوٓا اَجْرَهُمْ بِاَحْسَنِ مَا كَانُوا يَعْمَلُونَ ﴿٩٦﴾ مَنْ عَمِلَ صَالِحًا مِنْ ذَكَرٍ اَوْ اُنْثٰى
وَهُوَ مُؤْمِنٌ فَلَنُحْيِيَنَّهُ حَيٰوةً طَيِّبَةً ۚ وَلَنَجْزِيَنَّهُمْ اَجْرَهُمْ بِاَحْسَنِ مَا كَانُوا يَعْمَلُونَ ﴿٩٧﴾ فَاِذَا قَرَأْتَ
الْقُرْاٰنَ فَاسْتَعِذْ بِاللّٰهِ مِنَ الشَّيْطَانِ الرَّجِيمِ ﴿٩٨﴾ اِنَّهُ لَيْسَ لَهُ سُلْطَانٌ عَلَى الَّذِينَ اٰمَنُوا وَعَلٰى رَبِّهِمْ
يَتَوَكَّلُونَ ﴿٩٩﴾ اِنَّمَا سُلْطَانُهُ عَلَى الَّذِينَ يَتَوَلَّوْنَهُ وَالَّذِينَ هُمْ بِهٖ مُشْرِكُونَ ۚ ﴿١٠٠﴾ وَاِذَا بَدَّلْنَا اٰيَةً
مَكَانَ اٰيَةٍ وَاللّٰهُ اَعْلَمُ بِمَا يُنَزِّلُ

---

(وَلَنَجْزِيَنَّ الَّذِينَ صَبَرُوا اَجْرَهُمْ بِاَحْسَنِ مَا كَانُوا يَعْمَلُونَ) – (əhdlərinə vəfalı olub islamın zəhmət və məşəqqətlərinə) **səbir edənlərə** (dünyada) **etdikləri** (yaxşı) **əməllərinin əcrini daha yaxşı və gözəl şəkildə verib,** (onları əbədi nemətlərə qərq edərik)**.**

**97)** (مَنْ عَمِلَ صَالِحًا مِنْ ذَكَرٍ اَوْ اُنْثٰى وَهُوَ مُؤْمِنٌ) **– kişi və qadınlardan kim ki,** (Qurani-Şərifə) **iman gətirdiyi halda, saleh əməl etsə,** (فَلَنُحْيِيَنَّهُ حَيٰوةً طَيِّبَةً) **- o şəxsə dünyada pak və pakizə həyat verib** (ömrünü gözəl şəkildə tamamlayarıq. Əgər mömin şəxs varlı olsa, çox gözəldir, əgər yoxsul olub Allah-Təalanın verdiyi ruziyə qənaət edib şükür etsə, haramdan çəkinsə, hər ikisinin də dünyadakı həyatı pak və pakizə olar)**.** (وَلَنَجْزِيَنَّهُمْ اَجْرَهُمْ بِاَحْسَنِ مَا كَانُوا يَعْمَلُونَ) – (dünyada) **etdikləri əməllərinin əcrini** (axirətdə) **daha gözəl şəkildə onlara verib,** (əbədi nemətlərlə onları rahat edərik)**.**

**98)** (فَاِذَا قَرَأْتَ الْقُرْاٰنَ فَاسْتَعِذْ بِاللّٰهِ مِنَ الشَّيْطَانِ الرَّجِيمِ) - (ey Məhəmməd)**, nə zaman Quran oxumaq istəsən, əvvəlcə** (Allah-Təalanın dərgahından) **qovulan şeytandan** (xəbis nəfsi-əmmarədən) **Allah-Təalaya pənah aparıb** (sonra Quran oxumağa başla. Hz. Peyğəmbər buyurubdur: "Quran oxumaqdan əvvəl belə deyin: "Əuzu billahi minəş-şeytanir-rəcim" (Tirmizi, Səvabul-Quran 22), ondan sonra Quran oxumağa başlayın." Abdullah ibn Məsud Quran oxuyanda deyirdi: "Əuzu billahis-səmiil-alim minəş-şeytanir-rəcim", Hz. Peyğəmbər buyurubdur: "Elə demə, yuxarıdakı kimi de." (Qazı Beyzavi, III/640))

**99)** (اِنَّهُ لَيْسَ لَهُ سُلْطَانٌ عَلَى الَّذِينَ اٰمَنُوا وَعَلٰى رَبِّهِمْ يَتَوَكَّلُونَ) **- həqiqətən, iman gətirib öz rəbləri Allah-Təalaya təvəkkül edən şəxslərə şeytanın heç bir hökmü yoxdur.** (Onlar şeytanın vəsvəsəsinə itaət etməyib Allah-Təalaya asi olmazlar)**.**

**100)** (اِنَّمَا سُلْطَانُهُ عَلَى الَّذِينَ يَتَوَلَّوْنَهُ وَالَّذِينَ هُمْ بِهٖ مُشْرِكُونَ) **- həqiqətən, şeytanın hökmü onu dost tutub Allah-Təalaya şərik qoşanların üzərinədir.**

**101)** (وَاِذَا بَدَّلْنَا اٰيَةً مَكَانَ اٰيَةٍ وَاللّٰهُ اَعْلَمُ بِمَا يُنَزِّلُ) – (Allah-Təala zamanın şərtlərinə görə hökmlər verər. Başqa bir zamanda o hökm məsləhət olmadığına görə, onun əvəzinə başqa hökm verib ilk hökmü "nəsx" – hökmsüz edərdi. Bu səbəbdən Qüreyş tənə edib deyirdi: "Məhəmməd səhabələrinə istehza edir, bu gün bir şeyi əmr edib sabah o şeyi qadağan edir." Allah-Təala onların cava-

قَالُوٓا اِنَّمَآ اَنْتَ مُفْتَرٍ بَلْ اَكْثَرُهُمْ لَا يَعْلَمُونَ ﴿١٠١﴾ قُلْ نَزَّلَهُ رُوحُ الْقُدُسِ مِنْ رَبِّكَ بِالْحَقِّ لِيُثَبِّتَ
الَّذ۪ينَ اٰمَنُوا وَهُدًى وَبُشْرٰى لِلْمُسْلِم۪ينَ ﴿١٠٢﴾ وَلَقَدْ نَعْلَمُ اَنَّهُمْ يَقُولُونَ اِنَّمَا يُعَلِّمُهُ بَشَرٌ لِسَانُ
الَّذ۪ي يُلْحِدُونَ اِلَيْهِ اَعْجَمِيٌّ وَهٰذَا لِسَانٌ عَرَبِيٌّ مُب۪ينٌ ﴿١٠٣﴾

---

bında bu ayəni buyurur: “ey Məhəmməd)**, nə zaman bir ayəni nəsx** (hökmsüz) **edib onun yerinə başqa bir ayə gətirdikdə,** (onun faydasına özümüz agahıq)**,** (قَالُوا اِنَّمَا اَنْتَ مُفْتَرٍ) **-** (ey Məhəmməd)**, kafirlər sənə tənə edib dedilər: “Həqiqətən, sən** (Allah-Təalaya) **iftira edirsən,** (bu gün bir hökm, sabah başqa bir hökm gətirib onu nəsx etməklə Allah-Təalaya iftira edirsən)**.** (بَلْ اَكْثَرُهُمْ لَا يَعْلَمُونَ) **-** (ey Məhəmməd, onların dediyi kimi deyil, nəsx Allah-Təalanın hökmüdür)**, bəlkə onların çoxu** (nəsxin faydasına) **agah olmayıb** (sənin Allah-Təalaya iftira etdiyini iddia edirlər)**.**

**102)** (قُلْ نَزَّلَهُ رُوحُ الْقُدُسِ مِنْ رَبِّكَ بِالْحَقِّ) **-** (ey Məhəmməd, müşriklərə) **de ki,** (bu Quranı) **müqəddəs Ruh** (Cəbrayıl) **rəbbin Allah-Təaladan haqq və ədalətlə sənə nazil edib,** (hər zamanın öz şərtinə görə, Allah-Təala bir hökm veribdir)**.** (لِيُثَبِّتَ الَّذ۪ينَ اٰمَنُوا) **- belə ki, o** (nəsxin səbəbinə) **o iman gətirən şəxsləri** (imtahan edib, nəsxin haqq olduğunu iqrar etdiklərində Allah-Təala da onların qədəmlərini) **sabit edib** (islamda möhkəm və bərqərar etsin)**.** (وَهُدًى وَبُشْرٰى لِلْمُسْلِم۪ينَ) **–** (bu Quran) **ona itaət edən müsəlmanlardan ötrü hidayət və** (ilahi rəhmətə) **müjdədir.**

**103)** (وَلَقَدْ نَعْلَمُ اَنَّهُمْ يَقُولُونَ اِنَّمَا يُعَلِّمُهُ بَشَرٌ) **-** (Məkkədə Xuveytib ibn Əbdül-Uzzanın Yaiş adlı əcəm bir qulamı var idi, özü xristian olsa da, Hz. Peyğəmbərə iman gətirib islama daxil oldu. Bu qulam İncil və Tövrata agah idi, Qüreyş camaatı Hz. Peyğəmbərin qarşısında aciz qalandan sonra dedilər: “Bu Quranı Məhəmmədə o qulam öyrədib, təlim edir.” Allah-Təala onların cavabında bu ayəni buyurur: “ey Məhəmməd)**, həqiqətən, biz bunu bilirik ki,** (Qüreyş camaatı) **belə deyir: “**(o Quranı) **Ona öyrədən bir insandır”** (Yaişdir. Allah-Təala bu Quranı Məhəmmədə göndərməyibdir)**.** (لِسَانُ الَّذ۪ي يُلْحِدُونَ اِلَيْهِ اَعْجَمِيٌّ) **– ona** (Yaişə) **nisbət etdikləri dil əcəm dilidir,** (ərəb dili deyildir və Qüreyş camaatı nə ağılsız camaatdır, dərk etmirlər ki, əcəm ərəbcə necə belə kəlam deyər?) (وَهٰذَا لِسَانٌ عَرَبِيٌّ مُب۪ينٌ) **- halbuki bu** (Quranın) **dili açıq-aşkar ərəbcədir,** (o qulam ərəb deyil. Belə fəsih ərəb dilini sənə necə öyrədə bilər? Qüreyş camaatı özləri ən fəsih ərəblərdən olub Quranın müqabilində kəlam gətirməyə aciz qala-qala, əcəm bir şəxs necə belə kəlam düzəldib sənə təlim edə bilər? Bir də əgər o əcəm qulam belə fəsih kəlam deyə bilirsə, onu niyə sənə təlim edir? Hər halda özünə nisbət edib peyğəmbərlik iddia edərdi. Öz kamilliyini niyə sənə nisbət edir? Bu Qüreyş camaatı qəribə, ağılsız bir tayfadır. İnsan inadkarlıq edəndə elə sözlər danışar ki, ona istehza edərlər)**.**

اِنَّ الَّذِينَ لَا يُؤْمِنُونَ بِاٰيَاتِ اللّٰهِ لَا يَهْدِيهِمُ اللّٰهُ وَلَهُمْ عَذَابٌ اَلِيمٌ ﴿١٠٤﴾ اِنَّمَا يَفْتَرِي الْكَذِبَ الَّذِينَ
لَا يُؤْمِنُونَ بِاٰيَاتِ اللّٰهِ وَاُولٰٓئِكَ هُمُ الْكَاذِبُونَ ﴿١٠٥﴾ مَنْ كَفَرَ بِاللّٰهِ مِنْ بَعْدِ اِيمَانِهٖٓ اِلَّا مَنْ اُكْرِهَ وَقَلْبُهُ
مُطْمَئِنٌّ بِالْاِيمَانِ وَلٰكِنْ مَنْ شَرَحَ بِالْكُفْرِ صَدْرًا

---

**104)** (اِنَّ الَّذِينَ لَا يُؤْمِنُونَ بِاٰيَاتِ اللّٰهِ لَا يَهْدِيهِمُ اللّٰهُ وَلَهُمْ عَذَابٌ اَلِيمٌ) **- həqiqətən, Allah-Təalanın ayələrinə** (hökmlərinə) **iman gətirməyənləri Allah-Təala** (haqqa) **hidayət etməz və onlardan ötrü** (axirətdə) **böyük əzab vardır.**

**105)** (اِنَّمَا يَفْتَرِي الْكَذِبَ الَّذِينَ لَا يُؤْمِنُونَ بِاٰيَاتِ اللّٰهِ) **- həqiqətən, Allah-Təalanın ayə və ehkamına iman gətirməyən şəxslər ona iftira edib** (yalan isnad edər. O yalançı siz Qüreyş tayfasısınız, Məhəmməd deyil. Quran həqiqətən ona nazil olubdur)**.** (وَاُولٰٓئِكَ هُمُ الْكَاذِبُونَ) **-** (ey Məhəmməd, Qüreyş camaatı sənə yalançı deyir, elə deyil)**, yalançı onların özləridir** (ki, Allah-Təalaya iman gətirməyib öz uydurduqları sözləri Allah-Təalaya isnad edirlər)**.**

**106)** (مَنْ كَفَرَ بِاللّٰهِ مِنْ بَعْدِ اِيمَانِهٖٓ اِلَّا مَنْ اُكْرِهَ وَقَلْبُهُ مُطْمَئِنٌّ بِالْاِيمَانِ) **-** (Məkkədə Əli ibn Əbu Talib və Xədicədən sonra islama ilk daxil olub iman gətirənlər bunlardır: 1-Zeyd ibn Harisə 2-Əbu Bəkir 3-Xabbab 4- Süheyb 5-Bilal 6-Əmmar 7-atası Yasir 8-anası Sümeyyə. Əbu Bəkirin özü camaatın arasında möhtərəm şəxs idi, həm də qəbiləsinin gücünə görə, ona əziyyət edə bilmədilər. Amma o biri müsəlmanlara son dərəcə əziyyət etdilər. Hər birinə bir cür əziyyət edirdilər. Bilalı aparıb çöldə günəşin altında sinəsinə daş yığıb ona deyirdilər: "Məhəmmədi inkar et." Daşın altında deyirdi: "Əhəd, Əhəd (Allah birdir)." Ondan sonra Əbu Bəkir onu alıb azad etdi. Əmmarı və ata-anasını tutub dedilər: "Məhəmmədi inkar edin." Əmmar təqiyyə edib xilas oldu. Ağlaya-ağlaya gəldi, Hz. Peyğəmbər onun gözünün yaşını silib buyurdu: "Əgər yenə sənə kafir olmağı təklif etsələr, təqiyyə edib kafir ol." Əmmardan başqa da bir neçəsi təqiyyə edib xilas oldu, amma Əmmarın atası və anası təqiyyəni tərk edib mürtəd olmadılar. Atasını öldürdülər, anasını iki dəvənin arasına bağlayıb, dartdılar, xəncərlə qəlbinə vurub həlak etdilər. Dedilər: "Sən kişilərə görə müsəlman olubsan." Bu iki nəfər (ər-arvad) islamda ilk şəhid olanlardır. Allah onlardan razı olsun. Sual: Əmmarın əməli yaxşıdır, yoxsa ata-anasının? Cavab: ata-anasının, çünki təqiyyəni tərk edib öldürülməyə səbir etmək o dövrdə islamın möhkəmlənməsinə və yayılmasına səbəb oldu. Təqiyyə edib mürtəd olanlar öz əməllərinə şübhə etdiklərindən bu ayə nazil oldu. Ayənin mənası belədir:) **Qəlbi imanla dolu olduğu halda** (zorla mürtəd olmağa) **məcbur edilən şəxs** (Əmmar və başqaları kimi) **istisna olmaqla, imana daxil olandan sonra kim** (mürtəd və) **kafir olsa, onlardan ötrü Allah-Təala yanında əzab vardır.** (Zorla mürtəd olan şəxsə heç bir xof və zərər yoxdur)**.** (وَلٰكِنْ مَنْ شَرَحَ بِالْكُفْرِ صَدْرًا) **- lakin kim** (öz ixtiyarı ilə) **qəlbini küfrə açsa,** (onun zərəri

فَعَلَيْهِمْ غَضَبٌ مِنَ اللّٰهِۚ وَلَهُمْ عَذَابٌ عَظِيمٌ ﴿١٠٦﴾ ذٰلِكَ بِاَنَّهُمُ اسْتَحَبُّوا الْحَيٰوةَ الدُّنْيَا عَلَى الْاٰخِرَةِۙ
وَاَنَّ اللّٰهَ لَا يَهْدِي الْقَوْمَ الْكَافِرِينَ ﴿١٠٧﴾ اُولٰٓئِكَ الَّذِينَ طَبَعَ اللّٰهُ عَلٰى قُلُوبِهِمْ وَسَمْعِهِمْ وَاَبْصَارِهِمْ
ۚ وَاُولٰٓئِكَ هُمُ الْغَافِلُونَ ﴿١٠٨﴾ لَا جَرَمَ اَنَّهُمْ فِي الْاٰخِرَةِ هُمُ الْخَاسِرُونَ ﴿١٠٩﴾ ثُمَّ اِنَّ رَبَّكَ
لِلَّذِينَ هَاجَرُوا مِنْ بَعْدِ مَا فُتِنُوا ثُمَّ جَاهَدُوا وَصَبَرُوٓاۙ

---

özünədir). (فَعَلَيْهِمْ غَضَبٌ مِنَ اللّٰهِ) **- Allah-Təalanın qəzəbi onlaradır.** (وَلَهُمْ عَذَابٌ عَظِيمٌ) **- onlardan ötrü** (axirətdə) **böyük əzab vardır.** (Hz. Peyğəmbərin zamanında müsəlmanlardan iki nəfəri Yəmamədə əsir tutub, yalançı peyğəmbər Müseyləmənin yanına apardılar. Birini hüzuruna gətirib dedi: “Məhəmmədin haqqında nə deyirsən?” Dedi: “Peyğəmbərdir.” Müseyləmə dedi: “Mənim haqqımda nə deyirsən?” O şəxs təqiyyə edib dedi: “Sən də peyğəmbərsən.” O şəxsi azad etdi. O birisini hüzuruna gətirtdi, dedi: “Məhəmmədin haqqında nə deyirsən?” Dedi: “Peyğəmbərdir.” Dedi: “Mənim haqqımda nə deyirsən?” O şəxs dedi: “Mənim qulağım kardır.” 3 dəfə sual etdi. O şəxs hər 3 dəfə də dedi: “Mənim qulağım kardır.” Müseyləmənin əmri ilə o şəxsi qətlə yetirdilər. Bu xəbəri Mədinədə Hz. Peyğəmbərə çatdırdılar. Buyurdu: “Birinci şəxs Allah-Təalanın icazəsinə əməl edib, (yəni Allah-Təala qorxu anında təqiyyəyə icazə veribdir), amma ikinci şəxs haqqından keçməyib, haqda möhkəm durub, Allah-Təalanın rəhməti onun üzərinə olsun.” Bu hədis təqiyyəni tərk edənin dərəcəsinin təqiyyə edəndən üstün olduğuna işarədir)**.**

**107)** (ذٰلِكَ بِاَنَّهُمُ اسْتَحَبُّوا الْحَيٰوةَ الدُّنْيَا عَلَى الْاٰخِرَةِ)– (mürtəd olan şəxslərə Allah-Təalanın qəzəb və əzabının olması o səbəbədir ki,) **onlar dünyanın həyatını axirətə üstün tutub,** (kafir olub islamdan çıxdılar)**.** (وَاَنَّ اللّٰهَ لَا يَهْدِي الْقَوْمَ الْكَافِرِينَ) **- həqiqətən,** (küfrlərində israr edib sabit olan) **kafir camaata Allah-Təala** (yardım edib, iman tərəfinə) **hidayət etməz.**

**108)** (اُولٰٓئِكَ الَّذِينَ طَبَعَ اللّٰهُ عَلٰى قُلُوبِهِمْ وَسَمْعِهِمْ وَاَبْصَارِهِمْ)**- bu kafir olanlar o şəxslərdir ki, Allah-Təala** (onların küfrləri səbəbinə) **qəlblərinə, qulaqlarına və gözlərinə möhür vurub** (haqqı görüb, eşitməkdən, dərk etməkdən məhrum, gözləri kor, qulaqları kar və qəlbləri qafil olubdur)**.** (وَاُولٰٓئِكَ هُمُ الْغَافِلُونَ) **- əlbəttə,** (aqibətlərindən) **qafil olub** (sonsuz qəflət içində olanlar) **onlardır.**

**109)** (لَا جَرَمَ اَنَّهُمْ فِي الْاٰخِرَةِ هُمُ الْخَاسِرُونَ) – (kafirlər öz əməlləri səbəbinə iman sərmayələrini zay edib)**, axirətdə** (əzab içində olub)**, özlərinə zərər vermələri haqq və sabitdir.**

**110)** (ثُمَّ اِنَّ رَبَّكَ لِلَّذِينَ هَاجَرُوا مِنْ بَعْدِ مَا فُتِنُوا) – (ey Məhəmməd, bu kafirlərin əhvalından agah olandan sonra bil ki)**, həqiqətən, sənin rəbbin Allah-Təala fitnəyə düşüb** (təqiyyə edib mürtəd olandan) **sonra** (Məkkədən) **hicrət edənləri,** (ثُمَّ جَاهَدُوا وَصَبَرُوا) – (hicrət edəndən) **sonra cihad edib, cihad etməkdə**

اِنَّ رَبَّكَ مِنْ بَعْدِهَا لَغَفُورٌ رَحِيمٌ ﴿١١٠﴾ يَوْمَ تَأْتِي كُلُّ نَفْسٍ تُجَادِلُ عَنْ نَفْسِهَا وَتُوَفّٰى كُلُّ نَفْسٍ
مَا عَمِلَتْ وَهُمْ لَا يُظْلَمُونَ ﴿١١١﴾ وَضَرَبَ اللّٰهُ مَثَلًا قَرْيَةً كَانَتْ اٰمِنَةً مُطْمَئِنَّةً يَأْتِيهَا رِزْقُهَا رَغَدًا
مِنْ كُلِّ مَكَانٍ فَكَفَرَتْ بِاَنْعُمِ اللّٰهِ فَاَذَاقَهَا اللّٰهُ لِبَاسَ الْجُوعِ وَالْخَوْفِ بِمَا كَانُوا يَصْنَعُونَ ﴿١١٢﴾
وَلَقَدْ جَٓاءَهُمْ رَسُولٌ مِنْهُمْ فَكَذَّبُوهُ فَاَخَذَهُمُ الْعَذَابُ وَهُمْ ظَالِمُونَ ﴿١١٣﴾ فَكُلُوا مِمَّا رَزَقَكُمُ اللّٰهُ
حَلَالًا طَيِّبًاۖ وَاشْكُرُوا نِعْمَتَ اللّٰهِ اِنْ كُنْتُمْ اِيَّاهُ تَعْبُدُونَ ﴿١١٤﴾

---

**səbir edənləri,** (اِنَّ رَبَّكَ مِنْ بَعْدِهَا لَغَفُورٌ رَحِيمٌ) – (fitnəyə düşüb təqiyyə üzrə mürtəd olandan) **sonra, həqiqətən, sənin rəbbin Allah-Təala onlara rəhm edib bağışlayandır.**

**111)** (يَوْمَ تَأْتِي كُلُّ نَفْسٍ تُجَادِلُ عَنْ نَفْسِهَا) **- qiyamət günü gəldikdə, hər kəs özünü xilas edib əzabdan xilas olmaq üçün mücadilə edib** (dünyada etdiyi əməllərdən ötrü üzrxahlıq gətirər ki, bəlkə, öz günahını başqasına həvalə etsin. Məsələn, belə deyər: "Böyüklər bizi zəlalətə saldılar", ya da: "Biz heç müşrik olmamışıq", belə üzrxahlıq gətirərlər. Amma bunların heç biri onlardan qəbul olunmaz). (وَتُوَفّٰى كُلُّ نَفْسٍ مَا عَمِلَتْ وَهُمْ لَا يُظْلَمُونَ) **- hər kəsə öz əməlinin əvəzi** (cəzası) **yetişər, heç vaxt onlara zülm olunmaz.**

**112)** (وَضَرَبَ اللّٰهُ مَثَلًا قَرْيَةً كَانَتْ اٰمِنَةً مُطْمَئِنَّةً) **- Allah-Təala** (müşriklərdən ötrü) **o şəhəri məsəl verir ki,** (o şəhərin əhli hər bir tərəfdən aram və xatircəm idilər). (يَأْتِيهَا رِزْقُهَا رَغَدًا مِنْ كُلِّ مَكَانٍ) – (o şəhərin əhlinə) **hər bir tərəfdən bol ruzilər gəlirdi.** (فَكَفَرَتْ بِاَنْعُمِ اللّٰهِ) – (lakin bu əhali şükür etmək əvəzinə) **Allahın nemətinə nankorluq edər.** (فَاَذَاقَهَا اللّٰهُ لِبَاسَ الْجُوعِ وَالْخَوْفِ بِمَا كَانُوا يَصْنَعُونَ) **– etdikləri əməllər** (nankorluq) **səbəbinə Allah-Təala onlara aclıq və qorxu libasını geydirib** (hər ikisinin əzabını o kafirlərə dadızdırar. Bu şəhərin əhalisi Məkkə müşriklərindən ötrü məsəldir, onlar əmin və xatircəm olduqları halda Allah-Təala onlara böyük nemət verib, Hz. Məhəmmədi (ə.s) onlara peyğəmbər göndərdi. Onu təkzib edib Məkkədən çıxartdılar, Allah-Təala da onları aclıq və digər bəlalara düçar etdi, islam onlara qalib oldu, özləri və dinləri yox oldu).

**113)** (وَلَقَدْ جَٓاءَهُمْ رَسُولٌ مِنْهُمْ فَكَذَّبُوهُ) **- həqiqətən, bu Məkkə əhlinə özlərindən peyğəmbər** (Hz. Məhəmməd əs.,) **gəldi,** (əvvəldə qeyd olunan şəhər əhalisi kimi Allah-Təalanın nemətlərinə şükür etməyib, peyğəmbəri) **təkzib etdilər.** (فَاَخَذَهُمُ الْعَذَابُ وَهُمْ ظَالِمُونَ) – (peyğəmbəri təkzib etmələri səbəbinə) **zalım olduqları halda, əzab onları yaxaladı** (qətl və qarət olunub zəlil oldular).

**114)** (فَكُلُوا مِمَّا رَزَقَكُمُ اللّٰهُ حَلَالًا طَيِّبًا) – (ey müşriklər, öz qərar verdiyiniz haramı, halalı bir kənara qoyub) **Allah-Təalanın sizə ruzi verdiyi halal və pak şeylərdən yeyin.** (وَاشْكُرُوا نِعْمَتَ اللّٰهِ اِنْ كُنْتُمْ اِيَّاهُ تَعْبُدُونَ) **- əgər** (Allah-Təalaya) **ibadət edənsinizsə, Allah-Təalanın** (verdiyi) **nemətlərə şükür edin.**

اِنَّمَا حَرَّمَ عَلَيْكُمُ الْمَيْتَةَ وَالدَّمَ وَلَحْمَ الْخِنْزِيرِ وَمَٓا اُهِلَّ لِغَيْرِ اللّٰهِ بِهٖۚ فَمَنِ اضْطُرَّ غَيْرَ بَاغٍ وَلَا عَادٍ فَاِنَّ اللّٰهَ
غَفُورٌ رَح۪يمٌ ﴿١١٥﴾ وَلَا تَقُولُوا لِمَا تَصِفُ اَلْسِنَتُكُمُ الْكَذِبَ هٰذَا حَلَالٌ وَهٰذَا حَرَامٌ لِتَفْتَرُوا عَلَى اللّٰهِ
الْكَذِبَۜ اِنَّ الَّذ۪ينَ يَفْتَرُونَ عَلَى اللّٰهِ الْكَذِبَ لَا يُفْلِحُونَۜ ﴿١١٦﴾ مَتَاعٌ قَل۪يلٌۖ وَلَهُمْ عَذَابٌ اَل۪يمٌ ﴿١١٧﴾
وَعَلَى الَّذ۪ينَ هَادُوا حَرَّمْنَا مَا قَصَصْنَا عَلَيْكَ مِنْ قَبْلُۚ وَمَا ظَلَمْنَاهُمْ وَلٰكِنْ كَانُٓوا اَنْفُسَهُمْ يَظْلِمُونَ
﴿١١٨﴾ ثُمَّ اِنَّ رَبَّكَ لِلَّذ۪ينَ عَمِلُوا السُّٓوءَ بِجَهَالَةٍ

---

**115)** (اِنَّمَا حَرَّمَ عَلَيْكُمُ الْمَيْتَةَ وَالدَّمَ) **- həqiqətən,** (Allah-Təala) **ölü** (heyvanın ətini və heyvanın başı kəsilən vaxt axan) **qanı sizə haram edibdir.** (وَلَحْمَ الْخِنْزِيرِ) **- və donuz ətini,** (وَمَٓا اُهِلَّ لِغَيْرِ اللّٰهِ بِهٖ) **- Allah-Təaladan başqasının** (bütlərin) **adına kəsilən heyvanı sizə haram edibdir.** (فَمَنِ اضْطُرَّ غَيْرَ بَاغٍ وَلَا عَادٍ) **- kim naçar qalıb, həddi aşmadan və başqasına zülm edib** (onun əlindəkini almadan bu qeyd olunan şeylərdən məcbur yesə), (فَاِنَّ اللّٰهَ غَفُورٌ رَح۪يمٌ) **- həqiqətən, Allah-Təala** (aclıq vaxtında bu haram şeyləri yeyənlərə) **rəhm edib onları bağışlayandır.** (Ayənin təfsirinin təfsilatı Bəqərə surəsində 173-cü ayədə keçdi)**.**

**116)** (وَلَا تَقُولُوا لِمَا تَصِفُ اَلْسِنَتُكُمُ الْكَذِبَ هٰذَا حَلَالٌ وَهٰذَا حَرَامٌ) – (Allah-Təalanın yeməklərdən haram etdiyi şeylər bunlardır, daha özünüzdən haram, halal təyin edib) **dilinizin vəsf etdiyi yalanlarla bu şey halal və bu şey haramdır, deməyin,** (halal, haram Allah-Təalanın təyin etdiyidir), (لِتَفْتَرُوا عَلَى اللّٰهِ الْكَذِبَ) – (ey müşriklər, halal, haram barəsində) **Allah-Təalaya yalandan iftira edib** (deməyin ki, Allah-Təala özü bunu halal, haram edibdir. Bu yalanları tərk edin)**.** (اِنَّ الَّذ۪ينَ يَفْتَرُونَ عَلَى اللّٰهِ الْكَذِبَ لَا يُفْلِحُونَ) **- Allah-Təalaya yalandan iftira edənlərə nicat yoxdur.** (Heç vaxt Allah-Təalanın əzabından nicat tapmazlar)**.**

**117)** (مَتَاعٌ قَل۪يلٌ وَلَهُمْ عَذَابٌ اَل۪يمٌ) – (Allah-Təalaya yalan isnad edib nemət əldə etmələri dünyanın az olan mənfəətidir. (Onlara heç bir faydası olmaz. Amma axirətdə) **onlardan ötrü şiddətli əzab vardır.** (Dünyanın az olan mənfəətindən ötrü axirətin əbədi əzabını seçmək aqil şəxslərin əməli deyildir)**.**

**118)** (وَعَلَى الَّذ۪ينَ هَادُوا حَرَّمْنَا مَا قَصَصْنَا عَلَيْكَ مِنْ قَبْلُ) - (ey Məhəmməd)**, yəhudilərə bundan əvvəl** (Ənam surəsində) **sənə zikr etdiyimiz şeyləri haram etdik.** (Ənam surəsində 146-cı ayədə zikr olunub)**,** (وَمَا ظَلَمْنَاهُمْ وَلٰكِنْ كَانُٓوا اَنْفُسَهُمْ يَظْلِمُونَ) **- biz yəhudilərə zülm etməyib** (Ənam surəsində zikr olunan şeyləri onlara haram etmədik)**. Bəlkə, onlar özlərinə zülm edib** (Allah-Təalaya asi olduqlarından cəza olsun deyə o şeyləri onlara haram etdik)**.**

**119)** (ثُمَّ اِنَّ رَبَّكَ لِلَّذ۪ينَ عَمِلُوا السُّٓوءَ بِجَهَالَةٍ) – (bu ayədən məqsəd Allah-Təalanın geniş rəhmətini bəndələrinə məlum edib onları ümidvar etmək və günahdan tövbə etməyə vadar etməkdir. Buyurur: "Ey Məhəmməd, müşriklərin əhvalatını zikr edəndən) **sonra, həqiqətən, sənin rəbbin cəhalət** (və nadanlıq)

ثُمَّ تَابُوا مِنْ بَعْدِ ذٰلِكَ وَاَصْلَحُوٓا اِنَّ رَبَّكَ مِنْ بَعْدِهَا لَغَفُورٌ رَحِيمٌ ﴿١١٩﴾ اِنَّ اِبْرٰهِيمَ كَانَ اُمَّةً
قَانِتًا لِلّٰهِ حَنِيفًاۜ وَلَمْ يَكُ مِنَ الْمُشْرِكِينَۙ ﴿١٢٠﴾ شَاكِرًا لِاَنْعُمِهِۜ اِجْتَبٰيهُ وَهَدٰيهُ اِلٰى صِرَاطٍ مُسْتَقِيمٍ
﴿١٢١﴾ وَاٰتَيْنَاهُ فِي الدُّنْيَا حَسَنَةًۜ وَاِنَّهُ فِي الْاٰخِرَةِ لَمِنَ الصَّالِحِينَۜ ﴿١٢٢﴾ ثُمَّ اَوْحَيْنَٓا اِلَيْكَ اَنِ
اتَّبِعْ مِلَّةَ اِبْرٰهِيمَ حَنِيفًاۜ وَمَا كَانَ مِنَ الْمُشْرِكِينَ ﴿١٢٣﴾ اِنَّمَا جُعِلَ السَّبْتُ عَلَى الَّذِينَ اخْتَلَفُوا فِيهِۜ

---

**səbəbilə günah edənləri,** (ثُمَّ تَابُوا مِنْ بَعْدِ ذٰلِكَ وَاَصْلَحُوا) – (cəhalət üzrə günah edəndən) **sonra tövbə edib əməllərini islah edib** (pis əməllər əvəzinə yaxşı əməllər edənləri), (اِنَّ رَبَّكَ مِنْ بَعْدِهَا لَغَفُورٌ رَحِيمٌ) – (ey Məhəmməd)**, həqiqətən, sənin rəbbin** (tövbə edəndən) **sonra günahkarları bağışlayıb onlara rəhm edəndir.”**

**120)** (اِنَّ اِبْرٰهِيمَ كَانَ اُمَّةً قَانِتًا لِلّٰهِ حَنِيفًا) **-** (ey Məhəmməd)**, həqiqətən, İbrahim özü** (xeyir və kamal sifətləri onda olduğuna görə) **tək bir ümmətdir və Allah-Təalanın itaətində olub batildən haqqa meyil edib** (sabit və bərqərar oldu)**.** (وَلَمْ يَكُ مِنَ الْمُشْرِكِينَ) **-** (Hz. İbrahim) **müşriklərdən deyildi.** (Bu müşriklər deyirlər ki, biz İbrahimin millətindənik. Yalan deyirlər, onda, gərək, İbrahim də bunlar kimi müşrik olaydı)**.**

**121)** (شَاكِرًا لِاَنْعُمِهِ) – (Hz. İbrahim Allah-Təalanın) **nemətlərinə şükür edən idi,** (اِجْتَبٰيهُ وَهَدٰيهُ اِلٰى صِرَاطٍ مُسْتَقِيمٍ) – (Allah-Təala İbrahimi özünə dost) **seçib düz yola** (haqq dinə) **onu hidayət etdi.**

**122)** (وَاٰتَيْنَاهُ فِي الدُّنْيَا حَسَنَةً) – **dünyada** (İbrahimə peyğəmbərlik) **bəxş edib** (bütün millətlərin yanında onu sevimli etdik, dünyada hər bir ümmət – yəhudi, xristian, müsəlman, müşrik, hamısı Hz. İbrahimi sevir)**.** (وَاِنَّهُ فِي الْاٰخِرَةِ لَمِنَ الصَّالِحِينَ) **- həqiqətən,** (İbrahim) **axirətdə də saleh şəxslərdəndir.**

**123)** (ثُمَّ اَوْحَيْنَٓا اِلَيْكَ اَنِ اتَّبِعْ مِلَّةَ اِبْرٰهِيمَ حَنِيفًا) **-** (ey Məhəmməd**, səni peyğəmbər edəndən sonra sənə vəhy etdik ki, İbrahimin din və şəriətinə tabe ol,** (hansı ki o özü digər dinlərdən meyil edib Allah-Təalanın əmrlərinə ram olub, itaətində sabit oldu)**,** (وَمَا كَانَ مِنَ الْمُشْرِكِينَ) – (bu müşriklər ki deyirlər: “İbrahim bizdən idi”, yalan deyirlər. Hz. İbrahim) **müşriklərdən deyildi.** (Xalis müvəhhid və müvəhhidlərin rəisi idi. Dünyada özünü ilk dəfə sünnət edən Hz. İbrahimdir, 90 yaşında özünü daş bıçaqla sünnət etmişdi. O zaman hər bir alət daşdan idi, bugünkü gündə də müsəlmanlar tərəfindən bilindiyi kimi, həcc mərasimini yerinə yetirib qurban kəsdi)**.**

**124)** (اِنَّمَا جُعِلَ السَّبْتُ عَلَى الَّذِينَ اخْتَلَفُوا فِيهِ) **- həqiqətən, şənbə gününün** (ehtiramını pozmanın əzabı) **ixtilaf edən o yəhudilərə verildi,** (şənbə günündə hər bir əməl onlara haram olandan sonra o gün dənizdən balıq tutmağı özlərinə

وَاِنَّ رَبَّكَ لَيَحْكُمُ بَيْنَهُمْ يَوْمَ الْقِيٰمَةِ فِيمَا كَانُوا فِيهِ يَخْتَلِفُونَ ﴿١٢٤﴾ اُدْعُ اِلٰى سَبِيلِ رَبِّكَ بِالْحِكْمَةِ
وَالْمَوْعِظَةِ الْحَسَنَةِ وَجَادِلْهُمْ بِالَّتِي هِيَ اَحْسَنُ اِنَّ رَبَّكَ هُوَ اَعْلَمُ بِمَنْ ضَلَّ عَنْ سَبِيلِهِ وَهُوَ اَعْلَمُ
بِالْمُهْتَدِينَ ﴿١٢٥﴾ وَاِنْ عَاقَبْتُمْ فَعَاقِبُوا بِمِثْلِ مَا عُوقِبْتُمْ بِهٖ

---

halal edib balıq ovladılar). (وَاِنَّ رَبَّكَ لَيَحْكُمُ بَيْنَهُمْ يَوْمَ الْقِيٰمَةِ فِيمَا كَانُوا فِيهِ يَخْتَلِفُونَ) - (ey Məhəmməd)**, həqiqətən, sənin rəbbin Allah-Təala qiyamət günündə** (şənbə gününün barəsində) **ixtilaf edib** (onu gah halal, gah da haram edən yəhudilərin arasında), **əlbəttə, hökm edəcəkdir.** (Şənbə gününün barəsində əzab olunan yəhudilərin əhvalatının təfsilatı Bəqərə surəsində 65-ci ayənin təfsirində qeyd olundu)**.**

**125)** (اُدْعُ اِلٰى سَبِيلِ رَبِّكَ بِالْحِكْمَةِ وَالْمَوْعِظَةِ الْحَسَنَةِ) - (ey Məhəmməd, xalqı) **Allah-Təalanın yoluna** (islam dininə, onda şəkk, şübhə olmayan möhkəm, səhih olan dəlil və sübutla)**, hikmət və gözəl nəsihət ilə dəvət edib çağır,** (ki, xalqa məlum olsun ki, sənin nəsihət etməkdə məqsədin onlara mənfəət verməkdir)**.** (وَجَادِلْهُمْ بِالَّتِي هِيَ اَحْسَنُ) – (islamı sübut etmək üçün) **ən gözəl şəkildə mübahisə və mücadilə edib** (qeyz və qəzəbi bir kənara qoyub insanlarla dostluq edib islamın gözəlliyini onlara bildir)**.** (اِنَّ رَبَّكَ هُوَ اَعْلَمُ بِمَنْ ضَلَّ عَنْ سَبِيلِهِ) - (ey Məhəmməd)**, həqiqətən, sənin rəbbin Allah-Təala zəlalətə düşənə** (asi olub heç bir öyüd-nəsihət qəbul etməyənə səndən daha çox agahdır)**.** (وَهُوَ اَعْلَمُ بِالْمُهْتَدِينَ) – (öyüd-nəsihəti qəbul edib) **hidayət tapan şəxslərə də Allah-Təala** (səndən daha çox) **agahdır.** (Amma sən Allah-Təala kimi onların əhvalına agah olmadığından müşriklərin iman etmələrini çox istəyirsən)**.**

**126)** (وَاِنْ عَاقَبْتُمْ فَعَاقِبُوا بِمِثْلِ مَا عُوقِبْتُمْ بِهٖ) - (bu surə Məkkədə nazil olub, ancaq bu ayə Mədinədə Uhud savaşından sonra nazil oldu. Uhud savaşında müsəlmanlardan 70 nəfər şəhid oldu, 64 nəfər ənsardan, 6 nəfər də mühacirlərdən, o cümlədən mühacirlərdən olan Həmzə şəhid oldu. Bu 70 nəfərin hamısı öləndən sonra Məkkə əhli Qüreyş camaatı onları "müslə" etdilər, (yəni, burun, qulaq, dodaqlarını kəsib qarınlarını parçaladılar), Həmzənin ciyərindən bir parçanı Əbu Süfyanın arvadı və Müaviyənin anası olan Hində apardılar. Hind onu ağzına salıb uddu, lakin qusub qaytardı. Hz. Peyğəmbər gəlib Həmzənin cəsədini o halda görəndə son dərəcə qəzəblənib buyurdu: "Əgər səndən sonra qalanlar məhzun və qəmgin olmasaydılar, hər halda buraxardım sənin bədənini quşlar və heyvanlar yeyib onların qarnından diriləydin. And olsun Allah-Təalaya, əgər Qüreyş camaatına qalib gəlsəm, hər halda sənin əvəzinə onlardan 70 nəfəri "müslə" edərəm". O zaman bu ayə nazil oldu. Ayənin mənası belədir: ey Məhəmməd)**, əgər** (düşməninizə əzab verib) **cəzalandıracaqsınızsa, sizə nə cəza verilibsə, siz də onun qədər onun əvəzinə** (əzab və) **cəza verin.** (Ondan artığı caiz deyildir. Həmzənin əvəzində əgər

**وَلَئِنْ صَبَرْتُمْ لَهُوَ خَيْرٌ لِلصَّابِرِينَ ﴿١٢٦﴾ وَاصْبِرْ وَمَا صَبْرُكَ اِلَّا بِاللّٰهِ وَلَا تَحْزَنْ عَلَيْهِمْ وَلَا تَكُ فِي ضَيْقٍ مِمَّا يَمْكُرُونَ ﴿١٢٧﴾ اِنَّ اللّٰهَ مَعَ الَّذِينَ اتَّقَوْا وَالَّذِينَ هُمْ مُحْسِنُونَ ﴿١٢٨﴾**

---

“müslə” eləmək istəsən, müşriklərdən bir nəfəri “müslə” edə bilərsən. Ondan artığı caiz deyildir). (وَلَئِنْ صَبَرْتُمْ لَهُوَ خَيْرٌ لِلصَّابِرِينَ) **- amma əgər səbir edib** (intiqam almasanız)**, əlbəttə, səbir edənlərdən ötrü bu daha yaxşıdır.** (Bu ayə nazil olduqda Hz. Peyğəmbər andından kəffarə verib dedi: “İlahi, səbir etdim”)**.**

**127)** (وَاصْبِرْ وَمَا صَبْرُكَ اِلَّا بِاللّٰهِ) - (ey Məhəmməd)**, səbir et. Sənin səbir etməyin də ancaq Allah-Təalanın yardımı ilədir.** (وَلَا تَحْزَنْ عَلَيْهِمْ) – (kafirlərin əməllərinə görə, möminlərə əziyyət verməl追rinə görə) **məhzun və qəmgin olma.** (وَلَا تَكُ فِي ضَيْقٍ مِمَّا يَمْكُرُونَ) - (kafirlərin) **məkr və hiylələrindən də sıxılma.**

**128)** (اِنَّ اللّٰهَ مَعَ الَّذِينَ اتَّقَوْا) **- həqiqətən, Allah-Təala müttəqi şəxslərə kömək olub** (lütf və rəhməti onlara şamildir)**.** (وَالَّذِينَ هُمْ مُحْسِنُونَ) **- bir də o şəxslərə ki, yaxşı əməl sahibləri olub** (düşmənlərini əfv edib bağışlayandırlar. Allah-Təala onlara kömək edəndir)**.**

Allaha həmd-səna olsun. Nəhl surəsinin təfsiri bitdi. Peyğəmbərimizin səhabələrindən olan Haram ibn Həyyan öləndə ona dedilər: “Vəsiyyət et.” Dedi: “Vəsiyyət maldan olar, mənim malım yoxdur, lakin sizə Nəhl surəsinin axırında olan ayələri vəsiyyət edirəm“. Bu cənabın vəsiyyəti bu qeyd olunan ayələrdə əfv, güzəşt edib səbir etməyə işarədir, bəli, keçmiş insanların ölərkən vəsiyyətləri bu sözlərə və insanlıq sifətlərinə sahib olmağa dəvət olurdu. Amma bizim bu zamanda varisin haqqını yeyib, birinə az, birinə çox vəsiyyət edirlər. Uca hidayət etdirici Hz. Peyğəmbər buyurubdur: “Nəhl surəsini kim oxusa, Allah-Təala ona dünyada bəxş etdiyi nemətlərdən sorğu-sual etməz.” (Qazı Beyzavi, Ənvarut-Tənzil, III/659; Zəməxşiri, Kəşşaf, II/436)



## əl-İSRA SURƏSİ

17-ci surədir. Məkkədə nazil olub, 111 ayə, 533 kəlmə, 3360 hərfdir.



بِسْمِ اللّٰهِ الرَّحْمٰنِ الرَّحِيمِ. سُبْحَانَ الَّذ۪ٓي اَسْرٰى بِعَبْدِه۪ لَيْلًا مِنَ الْمَسْجِدِ الْحَرَامِ اِلَى الْمَسْجِدِ الْاَقْصَا الَّذ۪ي بَارَكْنَا حَوْلَهُ لِنُرِيَهُ مِنْ اٰيَاتِنَاۜ اِنَّهُ هُوَ السَّم۪يعُ الْبَص۪يرُ ﴿١﴾

---

### Bismillahir-Rəhmanir-Rəhim

**1)** (سُبْحَانَ الَّذ۪ي اَسْرٰى بِعَبْدِه۪ لَيْلًا مِنَ الْمَسْجِدِ الْحَرَامِ اِلَى الْمَسْجِدِ الْاَقْصَا) **- gecənin** (bir vaxtında) **öz qulu*** (Məhəmmədi) **Məscidül-haramdan Məscidi-Əqsaya** (Beytül-müqəddəsə) **aparan Allah-Təala** (hər bir eyib və qüsurdan) **pak və müqəddəsdir.** (الَّذ۪ي بَارَكْنَا حَوْلَهُ لِنُرِيَهُ مِنْ اٰيَاتِنَا) – (Məscidi-Əqsa elə bir məsciddir ki)**, onun ətrafına** (Şam məmləkətinə) **bərəkət vermişik. Qəribə möcüzə və əlamətlərimizin bəzisini ona göstərməkdən ötrü** (qulumuz Məhəmmədi Məscidi-Əqsaya apardıq)**.** (Allah-Təalanın möcüzə və əlamətləri sonsuz olub peyğəmbərdə o qüvvə və imkan olmayıb ki, Allah-Təalanın bütün əlamətlərini əhatə etsin. Allah-Təala ona ancaq bəzi möcüzə və əlamətlərini göstərdi)**.** (اِنَّهُ هُوَ السَّم۪يعُ الْبَص۪يرُ) **-həqiqətən, Allah-Təala** (Məhəmmədin sözlərini) **eşidib** (hər bir əməlini) **görəndir.** (Onun gözəl əxlaqına və ixlaslı etiqadına agah olub, onu əziz, möhtərəm etdi)**.**

*(***Qeyd:** Təfsir və kəlam alimlərinin hamısı ittifaqla belə deyiblər: "Ayədəki "əbd" – qul sözündən məqsəd Hz. Məhəmməddir (ə.s)", və ittifaqla deyiblər ki, bu ayə merac barəsində nazil olubdur. Hərçənd bu ayədə Hz. Peyğəmbərin meracının səmalara olduğuna işarə yoxdur, amma bu ayəyə ən-Nəcm surəsinin ayəsini əlavə edəndə məqsəd məlum olur. Müsəlmanların içində Hz. Peyğəmbərin meracını inkar edən yoxdur. Amma iki məqamda ixtilaf olunubdur: birincisi, meracın vaxtı haqqında Ənəs ibn Malik və Həsən Bəsri deyibdir: "Bu, peyğəmbərlikdən qabaq olubdur. Bu söz əslsizdir və məqbul deyildir." Bu iki nəfərdən başqa, bütün səhabələr və tabein deyib: "Merac hicrətdən bir il qabaq olubdur." İkinci ixtilaf meracın xüsusiyyəti haqqındadır. Aişə deyibdir: "And olsun Allah-Təalaya, Hz. Peyğəmbərin bədəni heç vaxt bizim aramızdan qeyb olmadı. Ancaq onun müqəddəs ruhunu səmaya qaldırdılar." Müaviyə də Aişə deyən kimi rəvayət edibdir. Həsən Bəsri deyibdir: "Hz. Peyğəmbərin meracı yuxuda olubdur. Meracda olan əhvalatın hamısını Hz. Peyğəmbər yuxuda görübdür." Bunlardan başqa digər səhabələr və filosoflar istisna olmaqla üləmaların əksəriyyəti meracın cismaniliyinə inanıb belə deyiblər: "Hz. Peyğəmbər pak cismi ilə səmalara qalxdı." Amma islam filosofları meracın ruhani olduğunu deyiblər. Nəticə olaraq, meracın həqiqətində bu ixtilaflar vardır, amma meracın vaqe olmasında islam ümməti arasında ixtilaf yoxdur.*

*Merac əhvalatını ixtisarla belə qeyd ediblər: "O gecə ki merac oldu, o gecənin ertəsi günü səhər Hz. Peyğəmbər merac əhvalatını Əbu Talibin qızı Ümmü Haniyə anlatdı." Dedi: "Bu gecə məni buradan Beytül-müqəddəsə apardılar, oradan da səmaya qalxdım." Ondan sonra Hz. Peyğəmbər istədi ki, Ümmü Haninin evindən çıxıb getsin, Ümmü Hani Hz. Peyğəmbərin libasından yapışıb dedi: "Evdən getmə." Hz. peyğəmbər dedi: "Niyə?" Ümmü Hani dedi: "Qorxuram, gedib Qüreyşə də danışasan, səni təkzib etsinlər." Buyurdu: "Qoy təkzib etsinlər, qorxum yoxdur." Ondan sonra çıxıb getdi. Gedib Məscidül-haramda oturdu. Əbu Cəhl gəlib Hz. Peyğəmbərin yanında əyləşib dedi: "Ey Məhəmməd, təzə bir şey var?" Dedi: "Bəli, var. Bu gecə mən səfərə getdim." Əbu Cəhl dedi: "Haraya getdin?" Dedi: "Beytül-müqəddəsə." Əbu Cəhl dedi: "Səhər yenə burada oldun?" Buyurdu: "Bəli." Əbu Cəhl heç bir söz deməyib inkar eləmədi. Qorxdu ki, əgər inkar etsə, Hz. Peyğəmbər da inkar edib daha camaata danışmasın. Dedi: "Bu sözləri necə ki mənə danışdın, qövmündən ötrü də danışarsan." Buyurdu: "Əlbəttə, danışaram." Əbu Cəhl durub səs-küy salıb dedi: "Ey Qüreyş camaatı, buraya gəlin." Qüreyş camaatı gəlib toplandılar. Əbu Cəhl dedi: "Ey Məhəmməd, danış görək, bu gecə hara getdin?" Buyurdu: "Bəli, bu gecə Beytül-müqəddəsə səfər etdim." Qüreyş belə qərib sözü eşidən kimi dedilər: "Gecə getdin, səhər yenə burada oldun?" Dedi: "Bəli." Qüreyş camaatının bəzisi əl çaldı, bəzisi əllərini başına qoydu, bəzisi də güldü. İslama daxil olanlardan bəzisi də mürtəd oldu. Müşriklərdən bir nəfər gedib Əbu Bəkirə xəbər verdi ki, sənin sahibin deyir ki, bu gecə Beytül-müqəddəsə gedib. Əbu Bəkir dedi: "Dəqiq bu sözü dedi?" O şəxs dedi: "Bəli." Əbu Bəkir dedi: "Əgər belə söz deyibsə, doğru deyibdir." O şəxs dedi: "Bəs sən onu təsdiq edirsən ki, bir gecədə Beytül-müqəddəsə gedib, sübh vaxtı burada olub?" Əbu Bəkir dedi: "Əgər desə ki, səmaya gedib gəlmişəm, yenə təsdiq edərəm." (Ondan sonra Əbu Bəkirə "siddiq" - doğru ləqəbi verildi), Qüreyş camaatının arasında Beytül-müqəddəsi görənlər var idi. Dedilər: "Məscidin vəsfini bizdən ötrü bəyan et." Hz. peyğəmbər bəyan etdi. Qüreyş camaatı Hz. Peyğəmbərin Beytül-müqəddəsə getmədiyini bilirdilər, onun sözlərini təsdiq etdilər, dedilər: "Məscidin vəsfini çox yaxşı, dürüst bəyan etdi." Qüreyş karvanı ildə bir dəfə Şama ticarətə gedərdi. O dövrdə karvanları Şamda idi. O səbəbdən dedilər: "Ey Məhəmməd, karvanımızdan bizə xəbər ver. Bəs onları yolda gördünmü?" Buyurdu: "Filan tayfanın karvanı Revha adlı yerdə idi. Bir dəvələri itmişdi. Onu axtarırdılar. Bir qab da suları var idi. Susamışdım, o suyu içdim. O karvan əhlindən soruşarsınız ki, belədir, ya yox? O qabdakı suyu gördülər, yoxsa yox?" Qüreyş camaatı dedilər: "Bu bir əlamətdir." Ondan sonra buyurdu: "Filan tayfanın karvanı, filankəs və filankəs Zi-Mər adlı yerdə ikisi bir dəvəyə minmişdilər. Dəvələri ürküb onları yerə çırpıb birinin əli sındı. Onlardan soruşarsınız ki, belədir, yoxsa yox?" Qüreyşlilər dedi: "Bizə öz karvanımızdan xəbər ver." Buyurdu: "Sizin karvanınızı Tənimdə gördüm. Bu qədər camaatı, bu qədər dəvələri var idi. Sübh vaxtı günəş doğanda Əqəbəyə tərəf gedin, görəcəksiniz. Hamısından qabaqda iki çuval yükü olan, ağ və qırmızı tüklü bir dəvə var." (Hz. Peyğəmbər hamısını adıyla bir-bir bəyan edibdir). Dedilər: "Bu böyük əlamətdir." Hamısı sübh vaxtı Əqəbəyə tərəf gedib karvanı gözlədilər. Bir nəfər dedi: "And olsun Allah-Təalaya, budur günəş doğdu", başqa biri dedi: "And olsun Allah-Təalaya, budur karvan gəldi, ağ, qırmızı tüklü dəvə də onların qabağında." Qüreyş camaatı bu əlaməti görsə də iman gətirmədi. Dedilər: "Bu, böyük sehrdir." Ondan sonra Hz. Peyğəmbər səmaya getdiyini onlara xəbər verdi. Küfr və inadları daha da artıb Hz. Peyğəmbərə daha çox düşmən oldular).*

وَاٰتَيْنَا مُوسَى الْكِتَابَ وَجَعَلْنَاهُ هُدًى لِبَنٖٓي اِسْرَٓاءٖيلَ اَلَّا تَتَّخِذُوا مِنْ دُونٖي وَكٖيلًاۜ ﴿٢﴾ ذُرِّيَّةَ مَنْ
حَمَلْنَا مَعَ نُوحٍؕ اِنَّهُ كَانَ عَبْدًا شَكُورًا ﴿٣﴾ وَقَضَيْنَٓا اِلٰى بَنٖٓي اِسْرَٓاءٖيلَ فِي الْكِتَابِ لَتُفْسِدُنَّ فِي
الْاَرْضِ مَرَّتَيْنِ وَلَتَعْلُنَّ عُلُوًّا كَبٖيرًا ﴿٤﴾ فَاِذَا جَٓاءَ وَعْدُ اُوليٰهُمَا بَعَثْنَا عَلَيْكُمْ عِبَادًا لَنَٓا اُولٖي بَأْسٍ
شَدٖيدٍ فَجَاسُوا خِلَالَ الدِّيَارِؕ وَكَانَ وَعْدًا مَفْعُولًا ﴿٥﴾

---

**2)** (وَاٰتَيْنَا مُوسَى الْكِتَابَ وَجَعَلْنَاهُ هُدًى لِبَنٖي اِسْرَٓاءٖيلَ) - (ey Məhəmməd)**, Musaya** (Tövrat) **kitabını verib onu bəni-İsraildən ötrü hidayət edib yol göstərən etdik.** (اَلَّا تَتَّخِذُوا مِنْ دُونٖي وَكٖيلًا) – (bəni-İsrailə dedik ki, Tövrata əməl edib) **məndən başqa özünüzə** (işinizi həvalə edəcəyiniz məbud) **vəkil tutmayın.**

**3)** (ذُرِّيَّةَ مَنْ حَمَلْنَا مَعَ نُوحٍ) **- ey Nuh ilə bərabər** (gəmidə) **daşıyıb** (nicat verdiyimiz) **nəsil,** (tufandan sonra Nuhun gəmisindəki 80 nəfərdən bəzisi Mosulda yerləşib, bəni-İsrail də onların nəslindən olduğuna görə bəni-İsrailə Nuhun nəsli kimi xitab edir.) (اِنَّهُ كَانَ عَبْدًا شَكُورًا) **- həqiqətən,** (Nuh Allah-Təalaya) **şükür edən bəndə olub** (hər bir əməlində Allah-Təalaya həmd-səna edirdi)**.**

**4)** (وَقَضَيْنَٓا اِلٰى بَنٖي اِسْرَٓاءٖيلَ فِي الْكِتَابِ) **- bəni-İsrailə** (qəti şəkildə Tövrat) **kitabında** (vəhy edib) **bildirdik ki,** (لَتُفْسِدُنَّ فِي الْاَرْضِ مَرَّتَيْنِ)**- əlbəttə, siz yer üzündə iki dəfə fəsad törədəcəksiniz.** (Bəni-İsrailin ilk fəsadı Zəkəriyanı qətlə yetirib Yeremya peyğəmbəri həbs etmələri, ikinci fəsadları Yəhyanı qətlə yetirib İsanı qətl etmək istəmələridir. Bu iki fəsadın hər birindən sonra Allah-Təala bəni-İsrailə zalım bir sultanı hakim edib onlardan intiqam aldı)**.** (وَلَتَعْلُنَّ عُلُوًّا كَبٖيرًا) **- əlbəttə, siz bəni-İsrail yer üzündə təkəbbürlənib, zalım olub,** (böyüklük iddiası edəcəksiniz)**.**

**5)** (فَاِذَا جَٓاءَ وَعْدُ اُوليٰهُمَا) - (bəni İsrailə o fəsadlarının) **birincisinin** (əzab) **vaxtı gəldikdə,** (بَعَثْنَا عَلَيْكُمْ عِبَادًا لَنَا اُولٖي بَأْسٍ شَدٖيدٍ) – (siz bəni-İsraildən intiqam almaq üçün) **üzərinizə cürətli və qüvvətli olan bəndələrimizi göndərdik,** (ki, Zəkəriyya və ondan başqa məzlumların intiqamını sizdən alsınlar)**.** (فَجَاسُوا خِلَالَ الدِّيَارِ) – (sizin) **vilayətlərin hər bir tərəfini və içərisini gəzib dolaşıb** (sizi qətlə yetirsinlər)**.** (وَكَانَ وَعْدًا مَفْعُولًا) – (Allah-Təalanın əzab) **vədi labüd idi,** (gərək vaqe olaydı. Necə ki vaqe oldu. Allah-Təala bəni-İsrailin ilk fəsadında onlara sultan Nebukadnezarı hakim etdi, ərəblər ona "Büxtünnəsr" deyirlər, Babil padşahı olub bəni-İsrailin dövlətini dağıdıb, bəni-İsrail padşahı Sidqiyanı tutub onun gözünün qabağında oğullarını qətlə yetirib, özünün gözlərini çıxarıb Babilə göndərdi. Ondan sonra Yerusəlimə və bəni-İsraldəki bütün evlərə od vurub yandırdı. Şəhərin qalasını dağıtdı. Beytül-müqəddəsdə nə ki bürünc və gümüş alətlər var idi, hamısını Babilə nəql etdi. Süleymanın düzəltdiyi 18 arşın hündürlüyündəki iki böyük sütunu, dənizdə olan bürünc sütunu və başlarında 3 arşın hündürlüyündə nar formasındakı bürüncdən olan tacları gö-

ثُمَّ رَدَدْنَا لَكُمُ الْكَرَّةَ عَلَيْهِمْ وَاَمْدَدْنَاكُمْ بِاَمْوَالٍ وَبَنِينَ وَجَعَلْنَاكُمْ اَكْثَرَ نَفِيرًا ﴿٦﴾ اِنْ اَحْسَنْتُمْ اَحْسَنْتُمْ لِاَنْفُسِكُمْ وَاِنْ اَسَأْتُمْ فَلَهَا فَاِذَا جَاءَ وَعْدُ الْاٰخِرَةِ لِيَسُؤُا وُجُوهَكُمْ وَلِيَدْخُلُوا الْمَسْجِدَ كَمَا دَخَلُوهُ اَوَّلَ مَرَّةٍ وَلِيُتَبِّرُوا مَا عَلَوْا تَتْبِيرًا ﴿٧﴾

---

türüb, bütün bəni-İsrail əyanlarını da əsir etdilər, Babil sərdarı Neburzaradan onları Babilə apardı, bəni-İsrail məmləkəti xarabaya dönüb, əhalisi də oranı tərk etdi**).**

**6)** (ثُمَّ رَدَدْنَا لَكُمُ الْكَرَّةَ عَلَيْهِمْ) – (bir neçə zaman keçəndən) **sonra** (siz bəni-İsrail tövbə etdiyinizdən sizə qüvvət verib yenidən düşmənlərinizə) **qalib edib** (dövlət və səltənəti sizə geri qaytardıq)**.** (وَاَمْدَدْنَاكُمْ بِاَمْوَالٍ وَبَنِينَ) **- sizə mal-dövlət, oğullar verib onlarla sizə kömək etdik.** (وَجَعَلْنَاكُمْ اَكْثَرَ نَفِيرًا) – **sayınızı** (əvvəlkindən də) **çox etdik.**

**7)** (اِنْ اَحْسَنْتُمْ اَحْسَنْتُمْ لِاَنْفُسِكُمْ) **- əgər siz** (bəni-İsrail camaatı)**, xeyir və saleh əməl etsəniz, o xeyir əməli öz mənfəətinizə edibsiniz,** (nə mənfəəti olsa, özünüzə aid olacaqdır)**.** (وَاِنْ اَسَأْتُمْ فَلَهَا) **- amma əgər pis və xəbis əməllər etsəniz, onun da zərəri və əzabı özünüzədir.** (Ondan başqasına bir zərər gəlməz. Bəni-İsrail düşmənlərinə qalib olub dövlət və səltənət sahibi olduqda, əvvəlki fəlakətli günlərini zamanla unudub tüğyan edib Allah-Təalaya asi olub Yəhya kimi zahid və abid, qədri uca peyğəmbəri qətlə yetirdilər. (Əgər tarix elmi o dövrdə bilinsəydi, hər halda, əvvəlki əhvalatlarını qeyd edib özlərindən sonra gələnlərə xatirə olub ibrət alardılar, yenidən tüğyan etməyib, bəla və müsibətə düçar olmazdılar. Nə gözəl və faydalı elmdir tarix elmi, din və dünya işlərinə kömək olan ilk elm tarix elmidir. Ağıl sahibləri diqqət etsinlər). Ruhullah, Kəlimətullah İsa ibn Məryəmi qətl etməyə cəhd etdilər. Əgər o cənabı Misirə aparıb mühafizə etməsəydilər, hər halda uşaq ikən onu tələf edərdilər. Bəni-İsrailin bu əməllərinə görə, Allah-Təala onları zəlil edib fars padşahı Böyük Daranı onlara hakim edib Yerusəlimi və bütün bəni-İsrail məmləkətini darmadağın etdi. Və Nebukadnezardan da qüdrətli olan padşahını və əyanlarını əsir edib, hamısını bir ipə bağlayıb, İrana sürgün etdi. Əsirlərin surətini və fəth əhvalatını Kirmanşah vilayətinin 25 mil məsafəsində olan Bisitun dağına həkk etdi. Bu rəsmlər zamanın gərdişinə dözüb, hələ də həmin dağda zahir və aşkardır. Bu qissəni Allah-Təala bundan sonra xəbər verir)**.** (فَاِذَا جَاءَ وَعْدُ الْاٰخِرَةِ) – (bəni-İsrail tüğyan edib) **ikinci fəsadlarının** (əzab) **vaxtı gəldikdə,** (İran padşahı Daranı İsrailə hakim etdik)**,** (لِيَسُؤُا وُجُوهَكُمْ) **- ki,** (fars xalqı sizə hakim və qalib olub) **üzünüzü** (qaraldıb) **qəm-qüssə əlamətini zahir eləsinlər.** (وَلِيَدْخُلُوا الْمَسْجِدَ كَمَا دَخَلُوهُ اَوَّلَ مَرَّةٍ) – (bu fars camaatı Beytül-müqəddəs) **məscidinə daxil olub** (onu xarab etsinlər)**, necə ki ilk dəfə** (fəsad törətdiklərində Babil camaatı) **ora daxil olub** (xarab etmişdilər)**.** (وَلِيُتَبِّرُوا مَا عَلَوْا تَتْبِيرًا) **- ki,** (bu fars camaatı sizə qalib və hakim olub) **hər bir şeyi məhv etsinlər.**

عَسٰى رَبُّكُمْ اَنْ يَرْحَمَكُمْۚ وَاِنْ عُدْتُمْ عُدْنَاۢ وَجَعَلْنَا جَهَنَّمَ لِلْكَافِرِينَ حَصِيرًا ﴿٨﴾ اِنَّ هٰذَا الْقُرْاٰنَ
يَهْدِي لِلَّتِي هِيَ اَقْوَمُ وَيُبَشِّرُ الْمُؤْمِنِينَ الَّذِينَ يَعْمَلُونَ الصَّالِحَاتِ اَنَّ لَهُمْ اَجْرًا كَبِيرًاۙ ﴿٩﴾ وَاَنَّ
الَّذِينَ لَا يُؤْمِنُونَ بِالْاٰخِرَةِ اَعْتَدْنَا لَهُمْ عَذَابًا اَلِيمًاۚ ﴿١٠﴾ وَيَدْعُ الْاِنْسَانُ بِالشَّرِّ دُعَٓاءَهُ بِالْخَيْرِۜ وَكَانَ
الْاِنْسَانُ عَجُولًا ﴿١١﴾ وَجَعَلْنَا الَّيْلَ وَالنَّهَارَ اٰيَتَيْنِ فَمَحَوْنَٓا اٰيَةَ الَّيْلِ وَجَعَلْنَٓا اٰيَةَ النَّهَارِ مُبْصِرَةً
لِتَبْتَغُوا فَضْلًا مِنْ رَبِّكُمْ وَلِتَعْلَمُوا عَدَدَ السِّنِينَ وَالْحِسَابَۜ وَكُلَّ شَيْءٍ فَصَّلْنَاهُ تَفْصِيلًا ﴿١٢﴾

---

**8)** (عَسٰى رَبُّكُمْ اَنْ يَرْحَمَكُمْ) **-** (bəni-İsrailə dedik ki, ey bəni-İsrail, əgər bu dəfə də tövbə edib Allah-Təalaya tərəf dönsəniz)**, ümidvar olun ki, Allah-Təala sizin tövbənizi qəbul edib sizə rəhm edəndir.** (وَاِنْ عُدْتُمْ عُدْنَا)– (ey bəni-İsrail, əgər tövbə edəndən sonra 3-cü dəfə də tövbəni pozub fəsada) **dönsəniz, biz də qayıdıb** (zalımları sizə hakim edib əzab edərik)**.** (وَجَعَلْنَا جَهَنَّمَ لِلْكَافِرِينَ حَصِيرًا) **- sizin kimi kafirlərdən ötrü cəhənnəmi zindan etdik.** (Oradan heç vaxt qurtula bilməzsiniz)**.**

**9)** (اِنَّ هٰذَا الْقُرْاٰنَ يَهْدِي لِلَّتِي هِيَ اَقْوَمُ) **-** (bəni-İsrail Tövrata müxalifət edib onlara əzab edildiyini müxtəsər qeyd edəndən sonra müsəlmanlar ibrət alsınlar deyə bu ayədə Qurana müxalif olanların əzabını və Qurana tabe olanların savabını bəyan edir. Ayənin mənası belədir:) **həqiqətən, bu Quran ən möhkəm və haqq olan yola** (islama) **hidayət edər,** (وَيُبَشِّرُ الْمُؤْمِنِينَ الَّذِينَ يَعْمَلُونَ الصَّالِحَاتِ اَنَّ لَهُمْ اَجْرًا كَبِيرًا) **- və iman gətirib saleh əməl edən şəxslərə müjdə ver ki, onlardan ötrü** (axirətdə) **böyük əcr vardır.**

**10)** (وَاَنَّ الَّذِينَ لَا يُؤْمِنُونَ بِالْاٰخِرَةِ اَعْتَدْنَا لَهُمْ عَذَابًا اَلِيمًا) **– və o şəxslər ki axirət gününə iman gətirməzlər, onlardan ötrü şiddətli əzab hazır etmişik.**

**11)** (وَيَدْعُ الْاِنْسَانُ بِالشَّرِّ دُعَٓاءَهُ بِالْخَيْرِ) **- insan** (qəzəb halında) **özünə xeyirdən ötrü dua etdiyi kimi şərdən ötrü də dua edər,** (necə ki) (وَكَانَ الْاِنْسَانُ عَجُولًا) **- insan** (hər bir işində) **tələsəndir.** (Qüreyşdən Nəzr ibnül-Haris dua edib dedi: "İlahi, əgər bu Quran haqdırsa, mənə əzab göndər." Bədir savaşında onu əsir edib qətlə yetirdilər)**.**

**12)** (وَجَعَلْنَا الَّيْلَ وَالنَّهَارَ اٰيَتَيْنِ) **-** (ey Məhəmməd)**, gecə və gündüzü** (tövhid və qüdrətimizə dair) **iki dəlil və sübut təyin etdik.** (فَمَحَوْنَٓا اٰيَةَ الَّيْلِ) **- gecənin əlamət olmağını** (qaranlığı) **silib,** (bəzi vaxtlarda ayın işığı olsa da günəşin müqabilində işıq hesab olunmaz)**,** (وَجَعَلْنَٓا اٰيَةَ النَّهَارِ مُبْصِرَةً) **- gündüzün əlamət olmağını** (işıqlığı, aydınlığı) **gətirdik,** (لِتَبْتَغُوا فَضْلًا مِنْ رَبِّكُمْ)**– ki,** (onun işıqlığıyla işlərinizi idarə edib) **rəbbiniz Allah-Təalanın lütfündən ruzi diləyəsiniz,** (وَلِتَعْلَمُوا عَدَدَ السِّنِينَ وَالْحِسَابَ) – (gecə və gündüzün müxtəlif olmağıyla) **illərin sayı və hesabından agah olasınız.** (وَكُلَّ شَيْءٍ فَصَّلْنَاهُ تَفْصِيلًا) – (din və dünya işlə-

وَكُلَّ اِنْسَانٍ اَلْزَمْنَاهُ طَٓائِرَهُ ف۪ي عُنُقِه۪ۜ وَنُخْرِجُ لَهُ يَوْمَ الْقِيٰمَةِ كِتَابًا يَلْقٰيهُ مَنْشُورًا ﴿١٣﴾ اِقْرَأْ كِتَابَكَۜ كَفٰى بِنَفْسِكَ الْيَوْمَ عَلَيْكَ حَس۪يبًاۜ ﴿١٤﴾ مَنِ اهْتَدٰى فَاِنَّمَا يَهْتَد۪ي لِنَفْسِه۪ۚ وَمَنْ ضَلَّ فَاِنَّمَا يَضِلُّ عَلَيْهَاۜ وَلَا تَزِرُ وَازِرَةٌ وِزْرَ اُخْرٰىۜ وَمَا كُنَّا مُعَذِّب۪ينَ حَتّٰى نَبْعَثَ رَسُولًا ﴿١٥﴾ وَاِذَٓا اَرَدْنَٓا اَنْ نُهْلِكَ قَرْيَةً اَمَرْنَا مُتْرَف۪يهَا فَفَسَقُوا ف۪يهَا فَحَقَّ عَلَيْهَا الْقَوْلُ فَدَمَّرْنَاهَا تَدْم۪يرًا ﴿١٦﴾

---

rinizdə ehtiyacınız olan) **şeylərin hamısını** (sizdən ötrü bu Quranda açıq-aşkar) **təfsilatı ilə bəyan etmişik.**

**13)** (وَكُلَّ اِنْسَانٍ اَلْزَمْنَاهُ طَٓائِرَهُ ف۪ي عُنُقِه۪) – (qiyamət günündə) **hər bir insanın əməlini** (boyun bağı) **kimi onun boynuna taxarıq.** (Heç vaxt ondan aralanmaz)**.** (وَنُخْرِجُ لَهُ يَوْمَ الْقِيٰمَةِ كِتَابًا يَلْقٰيهُ مَنْشُورًا) **- qiyamət günündə** (bütün əməlləri yazılmış olan) **bir kitabı açılmış olaraq qarşısına qoyarıq** (ki, oxusun)**.**

**14)** (اِقْرَأْ كِتَابَكَ) – (qiyamət günündə hər bir şəxsə deyilər)**: oxu bu kitabı** (ki, gör dünyada nə əməllər edibsən. O əməllər sənin yadından çıxıbdır. Amma Allah-Təala onların hamısını qoruyub, bu kitabda qeyd olunubdur. Sən dünyada belə xəyal edərdin ki, etdiyin əməllər yaddan çıxacaq. İndi sənə məlum oldu ki, sənin xəyal etdiyin kimi deyilmiş, bugünkü gündə öz əməlinə baxıb haqq-hesabını ver)**.** (كَفٰى بِنَفْسِكَ الْيَوْمَ عَلَيْكَ حَس۪يبًا) – (əməlinin) **hesabını verməndə sənin özün kifayət edərsən.** (Özün haqq-hesabını düşün ki, gör bu əməllərə mükafat düşür, yoxsa cəza. Dünyada oxumaq bilməyənlərin hamısı qiyamət günündə oxuya biləcək. Həsən Bəsri bu ayəni oxuyanda deyərdi: "Ey Adəm övladı, and olsun Allah-Təalaya ki, O, öz haqq-hesabınızı özünüzə həvalə edəcəkdir. Həqiqətən, sizinlə insafla rəftar edir")**.**

**15)** (مَنِ اهْتَدٰى فَاِنَّمَا يَهْتَد۪ي لِنَفْسِه۪) **- hidayət tapıb** (islama daxil olan)**, özünə xeyir verər.** (وَمَنْ ضَلَّ فَاِنَّمَا يَضِلُّ عَلَيْهَا) **- və zəlalətə düşüb** (islamdan çıxan da)**, həqiqətən, özünə zərər verər.** (Heç kimin əməli bir başqasına xeyir, ya da zərər verməz)**.** (وَلَا تَزِرُ وَازِرَةٌ وِزْرَ اُخْرٰى) **- heç bir günahkar şəxs bir başqa** (günahkarın) **günahını yüklənib** (onun əvəzinə əzab çəkməz)**.** (وَمَا كُنَّا مُعَذِّب۪ينَ حَتّٰى نَبْعَثَ رَسُولًا) **– peyğəmbər göndərmədiyimiz** (bir camaata) **əzab etmərik,** (bizim hikmətimizə yaraşmaz, ancaq peyğəmbərin dəvətinə qulaq asmayıb zəlalətdə qalanlara əzab edərik)**.**

**16)** (وَاِذَٓا اَرَدْنَٓا اَنْ نُهْلِكَ قَرْيَةً اَمَرْنَا مُتْرَف۪يهَا فَفَسَقُوا ف۪يهَا) – **biz** (əvvəlki ümmətlərdən olan) **bir şəhəri** (əhalisini öz əməlləri səbəbinə) **həlak etmək istədikdə** (və onların həlak olma zamanı yaxınlaşanda)**, onlara bol nemətlər verdik.** (O nemətlərə şükür etmək əvəzinə) **tüğyan edib fasiq oldular.** (Sanki o nemətləri onlara verib tüğyan edib fasiq olmalarını əmr etmişdik)**.** (فَحَقَّ عَلَيْهَا الْقَوْلُ) – (fasiq olmaqları səbəbinə əzab) **kəlməsi onlara layiq oldu.** (فَدَمَّرْنَاهَا تَدْم۪يرًا) – (onları həlak edib şəhərlərini) **darmadağın etdik.**

وَكَمْ اَهْلَكْنَا مِنَ الْقُرُونِ مِنْ بَعْدِ نُوحٍ وَكَفٰى بِرَبِّكَ بِذُنُوبِ عِبَادِه۪ خَب۪يرًا بَص۪يرًا ﴿١٧﴾ مَنْ كَانَ يُر۪يدُ
الْعَاجِلَةَ عَجَّلْنَا لَهُ ف۪يهَا مَا نَشَٓاءُ لِمَنْ نُر۪يدُ ثُمَّ جَعَلْنَا لَهُ جَهَنَّمَۚ يَصْلٰيهَا مَذْمُومًا مَدْحُورًا ﴿١٨﴾ وَمَنْ
اَرَادَ الْاٰخِرَةَ وَسَعٰى لَهَا سَعْيَهَا وَهُوَ مُؤْمِنٌ فَاُو۬لٰٓئِكَ كَانَ سَعْيُهُمْ مَشْكُورًا ﴿١٩﴾ كُلًّا نُمِدُّ هٰٓؤُ۬لَٓاءِ
وَهٰٓؤُ۬لَٓاءِ مِنْ عَطَٓاءِ رَبِّكَۜ وَمَا كَانَ عَطَٓاءُ رَبِّكَ مَحْظُورًا ﴿٢٠﴾ اُنْظُرْ كَيْفَ فَضَّلْنَا بَعْضَهُمْ عَلٰى بَعْضٍ
وَلَلْاٰخِرَةُ اَكْبَرُ دَرَجَاتٍ وَاَكْبَرُ تَفْض۪يلًا ﴿٢١﴾

---

**17)** (وَكَمْ اَهْلَكْنَا مِنَ الْقُرُونِ مِنْ بَعْدِ نُوحٍ) - (ey Məhəmməd), **Nuhdan sonra** (peyğəmbərləri təkzib edən) **nəsillərdən nə qədərini həlak etdik.** (Səni təkzib edənlər də əzabdan ötrü hazır olsunlar). (وَكَفٰى بِرَبِّكَ بِذُنُوبِ عِبَادِه۪ خَب۪يرًا بَص۪يرًا) - (ey Məhəmməd), **rəbbin Allah-Təalanın öz bəndələrinin günahını bilib görməsi kifayət edər.** (Əzab etmək üçün başqa bir şey ona lazım deyil).

**18)** (مَنْ كَانَ يُر۪يدُ الْعَاجِلَةَ عَجَّلْنَا لَهُ ف۪يهَا مَا نَشَٓاءُ لِمَنْ نُر۪يدُ) – **kim** (axirəti tərk edib) **fani** (dünyanı) **istəsə, onlardan istədiyimizə istədiyi şeyi** (dünyada) **verərik.** (Dünyada hər kəsə istədiyi şey verilməz, ancaq hikmət və məsləhət üzrə verilər). (ثُمَّ جَعَلْنَا لَهُ جَهَنَّمَۚ يَصْلٰيهَا مَذْمُومًا مَدْحُورًا)– (dünyada ona bəxş edəndən sonra axirətdə) **cəhənnəmi ondan ötrü məskən edib, məzəmmət olunub** (Allah-Təalanın rəhmətindən) **qovulmuş halda ora daxil olar.**

**19)** (وَمَنْ اَرَادَ الْاٰخِرَةَ وَسَعٰى لَهَا سَعْيَهَا وَهُوَ مُؤْمِنٌ) - **və kim axirəti istəyib** (axirətə) **iman etdiyi halda onun uğrunda səy edib** (saleh əməl etsə), (فَاُو۬لٰٓئِكَ كَانَ سَعْيُهُمْ مَشْكُورًا) - **belə şəxslərin əməlləri qəbul olub** (əməllərinin müqabilində onlara mükafat verilər).

**20)** (كُلًّا نُمِدُّ هٰٓؤُ۬لَٓاءِ وَهٰٓؤُ۬لَٓاءِ مِنْ عَطَٓاءِ رَبِّكَ) – (ey Məhəmməd, dünyanı istəyən hər kəsə) **rəbbin Allah-Təala bəxş edib,** (onların günahlarına görə) **ehsanını əsirgəməz.** (Dünyada mömin və fasiq hər ikisinə Allah-Təala ruzi bəxş edər. Ruzilərini kəsməz, amma axirətdə möminlərə nemət verib fasiq və asilərə əzab edəcəkdir). (وَمَا كَانَ عَطَٓاءُ رَبِّكَ مَحْظُورًا) **Ey Məhəmməd sənin rəbbin Allah Təalanın əta və bəxşişi xəlqin asiliyinə görə əksilən deyil. Dünyada mömin və fasiq hər ikisinə Allah rizi əta edir. Ruzilərini kəsməz, amma axirətdə möminlərə nemət verib fasiq və asilərə əzab edəcəkdir.**

**21)** (اُنْظُرْ كَيْفَ فَضَّلْنَا بَعْضَهُمْ عَلٰى بَعْضٍ) - (ey Məhəmməd), **bax gör ki,** (dünya əhlini) **bir-birindən necə üstün etmişik.** (Dünyada belə olduğu kimi axirətdə də belədir), (وَلَلْاٰخِرَةُ اَكْبَرُ دَرَجَاتٍ وَاَكْبَرُ تَفْض۪يلًا)– (dünya da* belə isə), **əlbəttə, axirət** (əhlinin) **dərəcələri və** (bir-birindən üstünlüyü) **daha böyük olacaqdır.**

*(*Qeyd: Mədinədə bir qrup adam Ömərin xilafəti zamanında onun hüzuruna daxil olmaq üçün izin istədilər. Bilal, bir də Süheybdən ötrü izin gəldi. Hansı ki səhabələr arasında bunlardan yoxsulu yox idi, digərlərinə izin verilmədi. Qüreyşin böyükləri*

**لَا تَجْعَلْ مَعَ اللّٰهِ اِلٰهًا اٰخَرَ فَتَقْعُدَ مَذْمُومًا مَخْذُولًا ﴿٢٢﴾ وَقَضٰى رَبُّكَ اَلَّا تَعْبُدُوٓا اِلَّٓا اِيَّاهُ وَبِالْوَالِدَيْنِ اِحْسَانًاۜ**

---

*olan Əbu Süfyana, Süheyl ibn Əmrə və digərlərinə bu məsələ çox ağır gəldi. Süheyl ibn Əmr dedi: "Bu bizim özümüzdən qaynaqlanır. Bizi də islama dəvət etdilər, onları da, onlar bizdən əvvələ keçib islama daxil oldular, bu səbəbdən də böyük məqam sahibi oldular. Bu Ömərin qapısıdır. Burada bir şey yoxdur. Bəs axirətdə bizimlə onların arasındakı fərq necə olacaqdır? Əgər Ömərin qapısında onlara həsəd edirsinizsə, axirətdə onlara verilən nemətlərə daha çox həsəd edəcəksiniz").*

**22)** (لَا تَجْعَلْ مَعَ اللّٰهِ اِلٰهًا اٰخَرَ) **-** (ey Məhəmməd)**, Allah-Təala ilə birlikdə başqa bir məbud qəbul edib** (sitayiş etmə və şərik qoşma. Qurani-Şərifin ayələri Hz. Peyğəmbərə xitab etdiyi kimi bu ayə də həm ona xitab edib, həm də bütün insanları tövhidə dəvət edir)**.** (فَتَقْعُدَ مَذْمُومًا مَخْذُولًا) **– (əgər Allah-Təalaya şərik qoşsan, o zaman** (axirət günündə Allah-Təala tərəfindən) **məzəmmət olunub** (bir tərəfdə) **zəlil və köməksiz oturub qalarsan,** (necə ki dünyada köməksiz olan bir şəxs bir guşədə zəlil və heysiyyətsiz oturub qalar. Allah-Təalaya şərik qoşduqların da sənə kömək etməz)**.**

**23)** (وَقَضٰى رَبُّكَ اَلَّا تَعْبُدُوا اِلَّا اِيَّاهُ) **-** (ey Məhəmməd)**, rəbbin Allah-Təala qəti əmr edibdir: gərək Allah-Təaladan başqa, heç bir şeyə ibadət etməyəsiniz.** (وَبِالْوَالِدَيْنِ اِحْسَانًا) **- gərək, ata və anaya ehsan və yaxşılıq edəsiniz.***

*(***Qeyd:** *Allah-Təalanın - ata və anaya itaət və yaxşılıq etmək hökmündə onlar kafirdir, yoxsa müsəlmandır, fərqi yoxdur, necə ki Hz. İbrahimin öz atası ilə olan rəftarından da belə məlum olur. Hz. peyğəmbərin səhabəsi Süfyan ibn Uyeynədən soruşdular: "Bir adam öləndən sonra ondan ötrü sədəqə verməyin savabı ona çatar, yoxsa yox?" Dedi: "Sədəqələrin savabı meyitə çatar. Amma meyitə günahının bağışlanmasını diləməkdən daha yaxşı mənfəət verən şey yoxdur. Əgər olsaydı, Allah-Təala ata və ana haqqında onu əmr edərdi, halbuki bağışlanmasını diləməkdən başqa bir şeyi əmr etməyibdir." Valideynlər haqqında Hz. Peyğəmbərdən varid olan hədislər həddindən çoxdur. Bir neçə hədisi burada qeyd edək. Bir kişi gəlib Hz. Peyğəmbərə ərz etdi ki, ey peyğəmbər, mənim ata və anam qocalıblar, necə ki onlar mənə uşaq olanda rəhm edib, xidmət edib qoruyublar, mən də indi onlara xidmət edib qoruyuram. Görəsən, onların haqqını ödəmişəm?" Hz. Peyğəmbər buyurubdur: "Xeyr, haqlarını ödəməyibsən, çünki onlar sənə uşaq vaxtı xidmət edib sağ qalmağını istəyirdilər. Amma sən onlara xidmət edib gözləyirsən ki, nə vaxt öləcəklər, sən də xilas olacaqsan. Sənin xidmətin onların xidmətinə əvəz ola bilməz." Bir başqa şəxs gəlib Hz. Peyğəmbərə şikayət etdi: "Ey Peyğəmbər, atam mənim malımı israf edir." Hz. Peyğəmbər onun atasını çağırtdırdı, gördülər bir qoca kişi əsaya söykənərək gəldi. Hz. Peyğəmbər bunun səbəbini soruşdu. Dedi: "Ey Peyğəmbər, vaxt var idi, mənim bu oğlum zəif idi, mən qüvvətli idim, o yoxsul və möhtac idi, mən varlı idim, heç bir malımı ondan əsirgəmədim, indi mən zəif olmuşam, o qüvvətli olub, mən yoxsul olmuşam, o varlı olub, malını məndən əsirgəyir." Hz.*

اِمَّا يَبْلُغَنَّ عِنْدَكَ الْكِبَرَ اَحَدُهُمَآ اَوْ كِلاهُمَا فَلا تَقُلْ لَهُمَآ اُفٍّ وَلا تَنْهَرْهُمَا وَقُلْ لَهُمَا قَوْلًا كَرِيمًا
﴿٢٣﴾ وَاخْفِضْ لَهُمَا جَنَاحَ الذُّلِّ مِنَ الرَّحْمَةِ وَقُلْ رَبِّ ارْحَمْهُمَا كَمَا رَبَّيَانِي صَغِيرًاؕ ﴿٢٤﴾

---

*Peyğəmbər o kişinin sözünə ağladı, buyurdu: “Ətrafdakı daş-kəsəklər də səndən ötrü ağladı.” Sonra o kişinin oğluna buyurdu: “Sən və malın hər ikisi atanındır. (Bu sözü iki dəfə dedi)”. Bir başqa şəxs gəlib Hz. Peyğəmbərə anasının bədxasiyyət olmasından şikayət elədi. Buyurdu: “O vaxt ki, o, hamilə olub 9 ay səni daşıdı, onda bədxasiyyət deyildi.” Dedi: “Ey peyğəmbər, anam bədxasiyyətdir.” Buyurdu: “Səndən ötrü gündüzlər zəhmət çəkib gecələr oyaq qalanda heç bədxasiyyət deyildi.” Dedi: “Ey peyğəmbər, mənə görə, çəkdiyi zəhmətlərin əvəzini ona vermişəm.” Buyurdu: “Nə edibsən?” Dedi: “Çiynimdə onu Məkkəyə aparmışam.” Buyurdu: “Səni doğarkən çəkdiyi bir ağrının əvəzini ona verməyibsən, nəinki digər əziyyətlərinin əvəzini.” Başqa bir hədisdə buyurubdur: “Ataya böyük yaxşılıq etmək odur ki, onun dostlarına yaxşılıq edilsin.” Bu barədə bir çox hədis varid olub bu bir neçə hədislə kifayətləndik. Görün ki, ata və ananın haqqı hikmət üzrə nə qədər mülahizə olunubdur. Necə ki qabaqda zikr olundu, ata və ana müsəlman, ya da kafir oldu, bu hökmlərdə heç bir fərqi yoxdur. Bədir savaşında Hüzeyfə müsəlmanlar arasında, atası Süheyl ibn Əmr müşriklərin arasında idi. Hüzeyfə Hz. Peyğəmbərdən atasını qətlə yetirmək üçün izin istədi. Buyurdu: “Sən bu işdən uzaq ol. Qoy səndən başqası bunu etsin.” İnsaflı şəxslər bu uca şəxsin rəftarına baxıb fikir versinlər. Oğlun öz müşrik atasını öldürməsinə razı olmur. Bəs belə bir şəxsi insafsız, mərhəmətsiz saymaq olarmı? Halbuki bəzi fanatik Avropa alimləri belə edir).*

(اِمَّا يَبْلُغَنَّ عِنْدَكَ الْكِبَرَ اَحَدُهُمَا اَوْ كِلَاهُمَا) – (ata-ananın) **biri, ya hər ikisi əgər sənin yanında qocalsa,** (səndən başqa yardımçıları, ya da övladı olmasa, o vaxt sənə lazımdır ki, onlara zamin olub istədiyi şeyləri edib, onlarla gözəl rəftar edib hər bir əziyyətlərinə dözəsən). (فَلَا تَقُلْ لَهُمَا اُفٍّ) – (əgər ata-ananın əziyyətini çəkib, zəhmətə düşüb, onlardan incisən, (necə ki bir şəxs bir şeydən inciyəndə - of kəlməsini deyər)**, sən də** (inciyəndə) **of demə.** (Belə ki, onlar da səndən inciyib xəcalət çəkməsinlər). (وَلَا تَنْهَرْهُمَا) – (əməllərinə görə) **onlara acıqlanma,** (وَقُلْ لَهُمَا قَوْلًا كَرِيمًا) – (ədəbə riayət edib, insaf və mürüvvəti gözləyib, acıqlanıb of deməyin əvəzində) **onlara yaxşı və gözəl sözlər deyib,** (gözəl şəkildə rəftar et. Valideynlə necə rəftar etməyi Hz. İbrahimdən öyrənmək lazımdır, atası kafir olduğu halda gör, onunla necə təvazökarlıq ilə danışır, Məryəm surəsində və digər surələrdə də bu mətləbə agah olmaq olar. Həqiqətən Allah-Təala ata-ana barəsində gözəl nəsihət edibdir. Allah-Təalanın ata-anaya hörmət və yaxşılıq etməyi öz tövhidiylə bir yerdə qeyd etməsindən daha böyük nə ola bilər?)

**24)** (وَاخْفِضْ لَهُمَا جَنَاحَ الذُّلِّ مِنَ الرَّحْمَةِ) – (bundan qabaq sən ata və anana möhtac idin necə sənə mehriban olub mühafizə ediblərsə, indi də onlar sənə möhtac olan zaman) **sən onlarla təvazökarlıq ilə** (xoş rəftar edib) **rəhm və mehribanlıq et,** (özünə istədiklərindən onlara da ver)**,** (وَقُلْ رَبِّ ارْحَمْهُمَا كَمَا رَبَّيَانِي صَغِيرًا)

رَبُّكُمْ اَعْلَمُ بِمَا فٖي نُفُوسِكُمْۜ اِنْ تَكُونُوا صَالِحٖينَ فَاِنَّهُ كَانَ لِلْاَوَّابٖينَ غَفُورًا ﴿٢٥﴾ وَاٰتِ ذَا الْقُرْبٰى
حَقَّهُ وَالْمِسْكٖينَ وَابْنَ السَّبٖيلِ وَلَا تُبَذِّرْ تَبْذٖيرًا ﴿٢٦﴾ اِنَّ الْمُبَذِّرٖينَ كَانُٓوا اِخْوَانَ الشَّيَاطٖينِۜ وَكَانَ
الشَّيْطَانُ لِرَبِّهٖ كَفُورًا ﴿٢٧﴾ وَاِمَّا تُعْرِضَنَّ عَنْهُمُ ابْتِغَٓاءَ رَحْمَةٍ مِنْ رَبِّكَ تَرْجُوهَا فَقُلْ لَهُمْ قَوْلًا
مَيْسُورًا ﴿٢٨﴾ وَلَا تَجْعَلْ يَدَكَ مَغْلُولَةً اِلٰى عُنُقِكَ

---

– (təkcə yaxşılıq etməklə kifayətlənməyib Allah-Təalaya dua et ki, axirətdə əbədi rəhmətini onlara şamil etsin. Dua edib belə) **de: “Ey mənim rəbbim,** (ata-anama) **rəhm edib** (təqsirlərindən keçib günahlarını bağışla)**, necə ki** (onlar mənə rəhm edib, aciz) **kişik uşaq olanda mənə tərbiyə verib** (hər bir bəladan məni qoruyublar)**.”**

**25)** (رَبُّكُمْ اَعْلَمُ بِمَا فٖي نُفُوسِكُمْ) **- rəbbiniz Allah-Təala qəlbinizdə olan şeylərdən** (ata-ananıza olan məhəbbət və itaətinizə) **agahdır.** (اِنْ تَكُونُوا صَالِحٖينَ) **- əgər** (qəsdiniz) **əməlisaleh olub** (ata-ananıza yaxşılıq və ehsan etmək fikrində olsanız, Allah-Təala sizə mükafat verər. Lakin ata-ananıza ədəbsizlik və əziyyət etsəniz, o vaxt gərək tövbə edib Allah-Təalaya dönəsiniz, Allah-Təala da sizin tövbənizi qəbul edər)**.** (فَاِنَّهُ كَانَ لِلْاَوَّابٖينَ غَفُورًا) **- həqiqətən, Allah-Təala tövbə edənlərə rəhm edib onları bağışlayandır.**

**26)** (وَاٰتِ ذَا الْقُرْبٰى حَقَّهُ) – (ey varlı şəxs, yoxsul) **qohum-əqrəbalarının haqqını** (öz malından) **ver.** (Varlı şəxsin malında yoxsul qohumlarının haqqı vardır. Gərək onları ac qalıb tələf olmağa qoymasın)**.** (وَالْمِسْكٖينَ وَابْنَ السَّبٖيلِ) **- habelə yoxsul və yoldan keçənlərin** (pulu qurtaranların haqqını öz malınızdan verin. Yəni onların da sizin malınızda haqqı var. Gərək, onlara kömək edəsiniz)**.** (وَلَا تُبَذِّرْ تَبْذٖيرًا) – (ey varlı şəxs)**, heç vaxt malını israf edib** (günah yolunda, riya və iftixar etmək üçün sərf etmə)**.**

**27)** (اِنَّ الْمُبَذِّرٖينَ كَانُٓوا اِخْوَانَ الشَّيَاطٖينِ) **- həqiqətən, malını israf edib** (günah yolda xərcləyən) **şəxslər** (xəbis) **şeytanların qardaşlarıdırlar.** (وَكَانَ الشَّيْطَانُ لِرَبِّهٖ كَفُورًا) – (onu da bilirsiniz ki)**, şeytan öz rəbbi Allah-Təalaya nankor olub** (onun itaətindən çıxıbdır. Belə şəxsə itaət edib ona qardaş olmaq ağılsızlıqdır. Belə əməl sahibləri səfehdir)**.**

**28)** (وَاِمَّا تُعْرِضَنَّ عَنْهُمُ ابْتِغَٓاءَ رَحْمَةٍ مِنْ رَبِّكَ تَرْجُوهَا) **- əgər** (qohum-əqrəbandan, yoxsul və yoldan keçəndən biri səndən bir şey istəsə)**, sən Allah-Təalanın mərhəmət** (və ruzisinə) **ümid etdiyin halda, bir şeyin olmayıb, onlardan üz çevirsən,** (belə vaxtda da onları cavabsız rədd etmə ki, qəlbləri inciməsin)**.** (فَقُلْ لَهُمْ قَوْلًا مَيْسُورًا) **- onlara yaxşı, gözəl şəkildə cavab verib** (qaytar)**.**

**29)** (وَلَا تَجْعَلْ يَدَكَ مَغْلُولَةً اِلٰى عُنُقِكَ) **- ***(ey varlı şəxs, əsir şəxsin əlini boynuna bağladıqları kimi)**, əlini boynuna bağlama,**

وَلَا تَبْسُطْهَا كُلَّ الْبَسْطِ فَتَقْعُدَ مَلُومًا مَحْسُورًا ﴿٢٩﴾

---

*(*Qeyd: Allah-Təala bu əməllərin heç birinə - nə israf etməyə, nə də xəsislik etməyə razı deyil, ehsan və sədəqə verəndə də orta yolu əmr edir, razı olmur ki, bir şəxs fəqir olub gedib dilənçilik etsin. Allah-Təala insanların zənginliyini istəyir ki, onun əmrlərinə əməl etsinlər, millətə xidmət edib, onların ehtiyaclarını həll etsinlər. Bu ən böyük dərəcədir. Hikmət sahibi Bozor-cemherdən soruşdular: "Var-dövlət yaxşıdır, yoxsa elm?" Dedi: "Elm." Dedilər: "Bəs niyə üləmaları zənginlərin qapılarında görürük?" Dedi: "Onlar elmi öyrəniblər, sonra da fikir verib görüblər ki, var-dövlətsiz elm əskikdir, indi də gəliblər var-dövlət əldə etsinlər." Həqiqətən də belədir, elm, əlbəttə, maldan yaxşıdır, necə ki Hz. Əlinin kəlamından elmin mala üstünlüyü məlum olur, amma Bozor-cemherin dediyi kimi, malsız elm də faydasızdır, gərək elm öyrənməklə birlikdə, var-dövlət də əldə edilsin. Ya da var-dövlətin yardımı ilə əldə edilən elm gərək din və millətə fayda versin. Din və millətə xidmət etməkdə var-dövlət əsas şərtdir. İslamın yayılmasının ilk səbəbi və köməyi Xədicənin malı oldu. O zaman necə demək olar ki, mal lazım deyil, tərki-dünya gərək edək, o şəxslər ki, adlarını vaiz qoyub vəz əsnasında xalqa tərki-dünya etməyi məsləhət görürlər, görəsən məqsədləri nədir? Halbuki özlərinin o vəzdən və cənnəti ucuz qiymətə satmaqdan məqsədləri qazanc əldə etməkdir. Bir də məqsədləri odur ki, dünya malını xalqın nəzərində pis göstərərək onların əlində olan malı bir az da alsınlar. Bu da bir qazanc yoludur. Amma varlı şəxslər belə məqamlarda gərək ayıq olub onların söz və əməllərinin bir-birinə zidd olduğunu, gərək, dərk etsinlər. Hidayət verən imamlara yalan hədisləri isnad etməkdə məqsəd də var-dövlət əldə etməkdir. Necə ki əmirəl-mömінin Hz. Əliyə isnad edib deyirlər: "O, bir dilənçiyə100 dəvə yükü ləl-cəvahirat verdi, Qənbər qaçdı, Hz. Əli ona dedi: "Niyə qaçdın?" Dedi: "Qorxdum ki, mənə də bağışlayasan". Əgər onlara desən ki, Hz. Əlidə bu qədər ləl-cəvahirat haradandır? Cavabında deyərlər ki, belə əməllər imamdan uzaq deyildir, habelə imam Zeynalabidinə də belə əməlləri isnad edirlər, guya əlini yuyanda əlinin suyu qabın içində almaz, yaqut, zümrüd olurdu, götürüb dilənçinin ətəyinə tökərdi. Müsəlmanların minbərlərində imamlara belə şeyləri isnad etmək xalqın nadanlığına işarədir. Əslində, var-dövlət yaxşı şeydir, insanın dini, dünyası onun malı ilə abad olar, nəinki yoxsul olması ilə. Hz. Peyğəmbər neçə dəfə dualarında yoxsul olmaqdan Allah-Təalaya pənah aparıbdır. İmam Fəxrəddin Razi deyir: "Təcrübə göstərir ki kişinin yeri elmi ilə, məlumdur. Elm əldə etmək də mal ilə mümkündür." Xüsusən şəriətə görə xeyri əmr, şəri qadağan edənlərin var-dövlətə daha çox ehtiyacı var. Bir yerdə ki, Allah-Təala bütün malı onun yolunda ehsan və sədəqə verməyə razı olmasın və malı qoruyub ədalətlə xərcləməyi əmr etsin, yenə demək olar ki, var-dövlət pisdir?)*

**Yəni xəsislik edib, Allah-Təala yolunda yuxarıda qeyd olunan şəxslərə, ya da onlardan başqalarına və ya müsəlmanların xeyri yolunda ehsan etməsən, bu şeytan əməlidir, tərk et).** (وَلَا تَبْسُطْهَا كُلَّ الْبَسْطِ)– (ehsan edən zaman da) **əlini tamam açma ki,** (bütün malını xərcləyib özün möhtac qalıb camaata yük olub dilənməyəsən. Bu əməl də qəbih əməldir. Bunu da tərk et)**.** (فَتَقْعُدَ مَلُومًا مَحْسُورًا)– (ki, bütün malını verəndən sonra dönüb Allah-Təala yanın-

**اِنَّ رَبَّكَ يَبْسُطُ الرِّزْقَ لِمَنْ يَشَٓاءُ وَيَقْدِرُۜ اِنَّهُ كَانَ بِعِبَادِه۪ خَب۪يرًا بَص۪يرًا۟ ﴿٣٠﴾ وَلَا تَقْتُلُٓوا اَوْلَادَكُمْ خَشْيَةَ اِمْلَاقٍۜ نَحْنُ نَرْزُقُهُمْ وَاِيَّاكُمْۜ اِنَّ قَتْلَهُمْ كَانَ خِطْـًٔا كَب۪يرًا ﴿٣١﴾ وَلَا تَقْرَبُوا الزِّنٰٓى اِنَّهُ كَانَ فَاحِشَةًۜ وَسَٓاءَ سَب۪يلًا ﴿٣٢﴾ وَلَا تَقْتُلُوا النَّفْسَ الَّت۪ي حَرَّمَ اللّٰهُ اِلَّا بِالْحَقِّۜ وَمَنْ قُتِلَ مَظْلُومًا فَقَدْ جَعَلْنَا لِوَلِيِّه۪ سُلْطَانًا فَلَا يُسْرِفْ فِي الْقَتْلِ اِنَّهُ كَانَ مَنْصُورًا ﴿٣٣﴾**

---

da) **məzəmmət olunmuş** (çünki Allah-Təala israfçı şəxsi sevməz)**, özün də əliboş qalıb,** (heç bir xeyir və mənfəətin olmaz)**.**

**30)** (اِنَّ رَبَّكَ يَبْسُطُ الرِّزْقَ لِمَنْ يَشَٓاءُ وَيَقْدِرُ) - (ey Məhəmməd)**, həqiqətən, sənin rəbbin Allah-Təala istədiyi şəxsin ruzisini bol edər, istədiyinə də dar edər.** (Hikmət və məsləhət üzrə birinə artıq, birinə əskik verər. Ruzi Allah-Təalanın qüdrətinə tabedir)**.** (اِنَّهُ كَانَ بِعِبَادِه۪ خَب۪يرًا بَص۪يرًا) **- Allah-Təala öz bəndələrinin əhvalına agah olub görür.** (Hər şəxsin öz xeyrinə görə ona ruzi verir. Hərçənd dünyada hər kəs varlı olmaq istəyir, amma Allah-Təala hər işin sonunu və insanlara nəyin xeyirli olub-olmadığını özlərindən yaxşı bilir. Bu səbəbdən ruziləri fərqli şəkildə qismət edir)**.**

**31)** (وَلَا تَقْتُلُٓوا اَوْلَادَكُمْ خَشْيَةَ اِمْلَاقٍ) **- övladlarınızı aclıq və yoxsulluq qorxusundan qətlə yetirməyin.** (Cahiliyyə zamanında bəzi ərəblər öz qızlarını yoxsulluqdan, ya da onlara ar gətirər deyə qətlə yetirirdilər, Allah-Təala bu ayədə bu qəbih əməli onlara qadağan edir)**.** (نَحْنُ نَرْزُقُهُمْ وَاِيَّاكُمْ) – (o qızlara) **və sizə ruzi verən bizik,** (niyə onları qətlə yetirirsiniz?) (اِنَّ قَتْلَهُمْ كَانَ خِطْـًٔا كَب۪يرًا) **- həqiqətən,** (o qız uşaqlarını) **qətlə yetirmək böyük günahdır.** (Allah-Təala buna görə, sizi sorğu-sual edəcək)**.**

**32)** (وَلَا تَقْرَبُوا الزِّنٰٓى) – (şəriətin əmr etdiyi qanundan başqa yolla qadınlarla) **zina etməyə yaxınlaşmayın.** (Zina böyük fəsadlara baisdir. Ən böyük fəsad da nəslin itib övladın bilinməməsidir)**.** (اِنَّهُ كَانَ فَاحِشَةً وَسَٓاءَ سَب۪يلًا) **- həqiqətən,** (zina) **son dərəcə qəbih əməldir və pis bir yoldur.** (Şəriətin əmr etdiyi yolu qoyub, onun xilafı olan yola tabe olub belə qəbih əmələ qurşanmayın)**.**

**33)** (وَلَا تَقْتُلُوا النَّفْسَ الَّت۪ي حَرَّمَ اللّٰهُ اِلَّا بِالْحَقِّ) – **haqq** (və ədalət) **üzrə olmadıqca, Allah-Təalanın öldürülməsini haram etdiyi bir kəsi öldürməyin,** (bu hallarda qətl etmək caizdir: 1-qətlə görə qisas almaqda 2-evli olanlar zina etdikdə, amma bunlardan başqa hallarda qəsdən qətl etmək haramdır. O şəxsin tövbəsi qəbul olunmayıb axirətdə həmişə əzab içində olacaqdır)**.** (وَمَنْ قُتِلَ مَظْلُومًا فَقَدْ جَعَلْنَا لِوَلِيِّه۪ سُلْطَانًا) **- kimi məzlum olduğu halda** (haqsız yerə) **öldürsələr, həqiqətən, biz onun sahibinə** (o qatilin üzərində) **tam ixtiyar vermişik.** (İstəsə diyət alar və ya diyətini bağışlayıb intiqamdan vaz keçər, ya da qatili qətlə yetirər), (فَلَا يُسْرِفْ فِي الْقَتْلِ اِنَّهُ كَانَ مَنْصُورًا) **- amma** (o da) **gərək qətl etməkdə* həddi aşmayıb,** (qatildən başqasını qətlə yetirməsin)**.**

وَلَا تَقْرَبُوا مَالَ الْيَتِيمِ اِلَّا بِالَّتِي هِيَ اَحْسَنُ حَتّٰى يَبْلُغَ اَشُدَّهُ وَاَوْفُوا بِالْعَهْدِ اِنَّ الْعَهْدَ كَانَ مَسْؤُلًا
﴿٣٤﴾ وَاَوْفُوا الْكَيْلَ اِذَا كِلْتُمْ وَزِنُوا بِالْقِسْطَاسِ الْمُسْتَقِيمِ ذٰلِكَ خَيْرٌ وَاَحْسَنُ تَأْوِيلًا ﴿٣٥﴾

---

*(*Qeyd: Öldürülən şəxs ərəblərin arasında görkəmli bir şəxs olsaydı, onun əvəzinə bir nəfərlə kifayətlənməyib, bir neçə nəfəri qətlə yetirərdilər, ya da qatil az tanınmış biri olduqda, o qatili öldürməyib, o qəbilədən olan böyük bir şəxsi qətlə yetirirdilər. Ərəblərin böyüklərindən Küleyb və Mühəlhəl iki qardaş idilər. Küleybi bəni-Mürrə camaatından bir nəfəri qətlə yetirdi, Mühəlhəl qardaşının qanını onun qatilindən almayıb, o qəbilənin böyüklərindən Büceyir ibn Harisi qətlə yetirdi. Dedi: "Bunu Küleybin ayaqqabı bağının əvəzində öldürdüm. Gərək, bütün bəni-Mürrə camaatını qətlə yetirəm ki, Küleybin qanına əvəz olsun." Bu qəbih adəti onların arasından götürmək üçün Allah-Təala bu ayəni nazil etdi. Əmirəl-möminin Hz. Əli öz qatili ibn Mülcəm xüsusunda vəsiyyət edib buyurdu: "Ey Həsən, apar bu kişini saxla, əgər mən bu yaradan nicat tapsam, mən onu bağışlamağa layiqəm, əgər mən ölsəm, o kişiyə ancaq bir zərbə vurarsınız, ona "müslə" (yəni meyitin burun, qulaq, dodaqlarını kəsib qarnını yırtmaq) etməyəsiniz, mən babanız Hz. Peyğəmbərdən də belə eşitdim." Yenə buyurdu: "Ey Əbdülmüttəlib övladı, mən öləndən sonra deyəcəksiniz ki, əmirəl-möminin öldürülüb, gərək, onun əvəzinə onun düşmənlərini öldürək, sizə tapşırıb deyirəm: mənim əvəzimə qatilimdən başqa, heç kimi qətlə yetirməyin." Müsəlmanların öz imamlarının vəsiyyətinə fikir verib ona tabe olmaları yaxşı əməl deyilmi? Ar olsun ona tabe olmayan müsəlmanlara!)*

Ölənin əvəzində ancaq onun qatili öldürülməlidir)**. Həqiqətən, elə şəxsə Allah-Təala kömək olub,** (ona ixtiyar verib ki, qisas alsın. O da Allah-Təala hökmünə, gərək, itaət edib qatildən başqasını qətlə yetirməsin)**.**

**34)** (وَلَا تَقْرَبُوا مَالَ الْيَتِيمِ اِلَّا بِالَّتِي هِيَ اَحْسَنُ) **- yetimlərin malına yaxınlaşıb** (onu xərcləməyin)**, ancaq gözəl və yaxşı şəkildə** (onların malını qoruyub ticarət yoluyla onu artırmaq məqsədilə yaxınlaşın, yetimlərin malını qorumaq lazımdır)**.** (حَتّٰى يَبْلُغَ اَشُدَّهُ) **- belə ki,** (o yetim ağıl-kamal sahibi olub) **həddi-büluğa çatana qədər,** (yəni o zamana qədər ki, istifadə etməsini bilib malını zay etməsin. O zamana qədər malından istədiyi kimi istifadə etməsi qadağandır, ancaq həddi-büluğa çatanda ona bu icazə verilər)**.** (وَاَوْفُوا بِالْعَهْدِ) – (Allah-Təala ilə olan) **əhdinizə vəfalı olun,** (Allah-Təala sizə ağıl verib ki, o ağlın sayəsində Allah-Təalanı tanıyıb müvəhhid olasınız)**.** (اِنَّ الْعَهْدَ كَانَ مَسْؤُلًا) **- həqiqətən,** (qiyamət günü insan etdiyi) **əhddən sorğu-sual olunacaq:** (Allah-Təala ilə olan əhdinizə vəfalı oldunuz, yoxsa yox?)

**35)** (وَاَوْفُوا الْكَيْلَ اِذَا كِلْتُمْ) – (ölçüylə satılan şeyləri) **ölçən vaxt düz ölçüb** (əskik etməyin)**.** (وَزِنُوا بِالْقِسْطَاسِ الْمُسْتَقِيمِ) – (çəkilən şeyləri) **çəkəndə düz** (tərəzi) **ilə çəkin.** (ذٰلِكَ خَيْرٌ وَاَحْسَنُ تَأْوِيلًا) – (çəkidə və ölçüdə düz olmaq) **sizin üçün daha yaxşı və nəticəsi** (Allah-Təala yanında) **daha gözəldir.**

وَلَا تَقْفُ مَا لَيْسَ لَكَ بِهِ عِلْمٌ اِنَّ السَّمْعَ وَالْبَصَرَ وَالْفُؤَادَ كُلُّ اُولٰئِكَ كَانَ عَنْهُ مَسْؤُلًا ﴿٣٦﴾ وَلَا تَمْشِ فِي الْاَرْضِ مَرَحًا اِنَّكَ لَنْ تَخْرِقَ الْاَرْضَ وَلَنْ تَبْلُغَ الْجِبَالَ طُولًا ﴿٣٧﴾ كُلُّ ذٰلِكَ كَانَ سَيِّئُهُ عِنْدَ رَبِّكَ مَكْرُوهًا ﴿٣٨﴾ ذٰلِكَ مِمَّا اَوْحٰى اِلَيْكَ رَبُّكَ مِنَ الْحِكْمَةِ وَلَا تَجْعَلْ مَعَ اللّٰهِ اِلٰهًا اٰخَرَ فَتُلْقٰى فِي جَهَنَّمَ مَلُومًا مَدْحُورًا ﴿٣٩﴾ اَفَاَصْفٰيكُمْ رَبُّكُمْ بِالْبَنِينَ وَاتَّخَذَ مِنَ الْمَلٰئِكَةِ اِنَاثًا اِنَّكُمْ لَتَقُولُونَ قَوْلًا عَظِيمًا ﴿٤٠﴾

---

**36)** (وَلَا تَقْفُ مَا لَيْسَ لَكَ بِهِ عِلْمٌ) - (ey Məhəmməd), **bilmədiyin şeyə** (hansı ki, qulağınla eşitməyib, gözünlə görməyib, qəlbinlə dərk etməyibsən, ona tabe olub) **dalınca getmə.** (Bəziləri bu ayə ilə ictihadın batil olduğunu iddia ediblər, çünki ictihad zənnə əsaslanır. Lakin bu iddia batildir. Şəriət ictihad məqamında zənni elm əvəzi sayıbdır. Səhabələrin hamısı ictihad ediblər. İkinci xəlifədən sonra Hz. Əliyə beyət etmək istədilər, buyurdu: “Mən peyğəmbərin sözlərilə, bir də öz ictihadımla əməl edərəm”). (اِنَّ السَّمْعَ وَالْبَصَرَ وَالْفُؤَادَ كُلُّ اُولٰئِكَ كَانَ عَنْهُ مَسْؤُلًا) - **həqiqətən, qulaq, göz, qəlb qiyamət günündə bunların hamısından sorğu-sual olunacaqdır.** (Yəni öz sahibinin etdiyi əməllərə şahidlik edəcəkdir).

**37)** (وَلَا تَمْشِ فِي الْاَرْضِ مَرَحًا) – (ey insan), **yer üzündə təkəbbürlə gəzib dolanma.** (اِنَّكَ لَنْ تَخْرِقَ الْاَرْضَ) – (nə qədər təkəbbürlü gəzsən də), **yeri yara bilməzsən.** (وَلَنْ تَبْلُغَ الْجِبَالَ طُولًا) - **əlbəttə,** (təkəbbür səbəbinə) **ucalıb dağların ucalığına çata bilməzsən.** (Bəs bu nə təkəbbür və qürurdur. Üstündə təkəbbürlə gəzdiyin o torpaq sənin bədənini bətninə alıb məhv edəcəkdir).

**38)** (كُلُّ ذٰلِكَ كَانَ سَيِّئُهُ عِنْدَ رَبِّكَ مَكْرُوهًا) - (ey Məhəmməd), **bu** (qeyd olunan ayələrdə qadağan olunan şeylərin) **hamısının günahı rəbbin Allah-Təalanın yanında xoşa gələn şey deyildir.**

**39)** (ذٰلِكَ مِمَّا اَوْحٰى اِلَيْكَ رَبُّكَ مِنَ الْحِكْمَةِ) - (ey Məhəmməd), **rəbbin Allah-Təalanın sənə vəhy edib** (göndərdiyi) **bu** (hökmlər) **hamısı hikmətdəndir.** (Əvvəlki ayələrdə qeyd olunan bu hökmlər bütün dinlərdə vacib olub nəsx və batil olmadığından möhkəm və hikmətli hökmlərdir). (وَلَا تَجْعَلْ مَعَ اللّٰهِ اِلٰهًا اٰخَرَ) - **Allah-Təala ilə birlikdə başqa məbud qəbul edib** (ona şərik qoşma). (فَتُلْقٰى فِي جَهَنَّمَ مَلُومًا مَدْحُورًا) – (əgər Allah-Təalaya şərik qoşsan), **məzəmmət olunmuş** (və hər bir xeyirdən) **qovulub uzaqlaşdırılmış halda cəhənnəmə atılarsan.**

**40)** (اَفَاَصْفٰيكُمْ رَبُّكُمْ بِالْبَنِينَ) – (bu ayə o şəxslərə xitabdır ki, belə deyirdilər: “Allah-Təala mələkləri özünə qız götürüb oğlu bizə veribdir”). **Bəs Allah-Təala oğulları sizin üçün seçib?** (وَاتَّخَذَ مِنَ الْمَلٰئِكَةِ اِنَاثًا) – **özü üçün mələklərdən qızları** (övladlığa) **götürüb?** (اِنَّكُمْ لَتَقُولُونَ قَوْلًا عَظِيمًا) - **həqiqətən, siz çox böyük danışıb** (Allah-Təalaya isnad edirsiniz. Özünüzü ondan üstün sayıb qızı Allah-Təalaya verib, oğulları özünüzə götürürsünüz, halbuki hamınız Allah-Təalanın qullarısınız).

وَلَقَدْ صَرَّفْنَا فِي هٰذَا الْقُرْاٰنِ لِيَذَّكَّرُواۜ وَمَا يَزِيدُهُمْ اِلَّا نُفُورًا ﴿٤١﴾ قُلْ لَوْ كَانَ مَعَهُ اٰلِهَةٌ كَمَا يَقُولُونَ
اِذًا لَابْتَغَوْا اِلٰى ذِي الْعَرْشِ سَبِيلًا ﴿٤٢﴾ سُبْحَانَهُ وَتَعَالٰى عَمَّا يَقُولُونَ عُلُوًّا كَبِيرًا ﴿٤٣﴾ تُسَبِّحُ لَهُ
السَّمٰوَاتُ السَّبْعُ وَالْاَرْضُ وَمَنْ فِيهِنَّۜ وَاِنْ مِنْ شَيْءٍ اِلَّا يُسَبِّحُ بِحَمْدِهٖ وَلٰكِنْ لَا تَفْقَهُونَ تَسْبِيحَهُمْۜ
اِنَّهُ كَانَ حَلِيمًا غَفُورًا ﴿٤٤﴾ وَاِذَا قَرَأْتَ الْقُرْاٰنَ جَعَلْنَا بَيْنَكَ وَبَيْنَ الَّذِينَ لَا يُؤْمِنُونَ بِالْاٰخِرَةِ حِجَابًا
مَسْتُورًاۙ ﴿٤٥﴾

---

**41)** (وَلَقَدْ صَرَّفْنَا فِي هٰذَا الْقُرْاٰنِ لِيَذَّكَّرُوا) **- həqiqətən, bu Quranda izah etdik** (ki, Allah-Təalanın övladı yoxdur və övlad sahibi olmaq ona layiq deyil)**. Belə ki, ibrət alıb** (Allah-Təalaya övlad isnad etməyi tərk etsinlər). (وَمَا يَزِيدُهُمْ اِلَّا نُفُورًا) – (bizim deməyimiz) **onları** (haqdan daha da uzaqlaşdırıb) **nifrətlərini artırdı.**

**42)** (قُلْ لَوْ كَانَ مَعَهُ اٰلِهَةٌ كَمَا يَقُولُونَ) **-** (ey Məhəmməd, müşriklərə) **de ki, əgər dediyiniz kimi Allah-Təala ilə birlikdə başqa məbudlar olsaydı,** (اِذًا لَابْتَغَوْا) (اِلٰى ذِي الْعَرْشِ سَبِيلًا) **- o zaman bu məbudlar ərşin sahibinə** (Allaha qalib gəlmək üçün) **yol axtarardılar.** (Necə ki dünyada hökmdarlar həmişə bir-birilərinə qalib gəlmək istəyirlər)**.**

**43)** (سُبْحَانَهُ وَتَعَالٰى عَمَّا يَقُولُونَ عُلُوًّا كَبِيرًا) **– Allah-Təala pak və müqəddəsdir,** (müşriklərin) **dediyi sözlərdən çox uca və böyükdür,** (Allah-Təala ona şərik qoşulmağa layiq deyil)**.**

**44)** (تُسَبِّحُ لَهُ السَّمٰوَاتُ السَّبْعُ وَالْاَرْضُ وَمَنْ فِيهِنَّ) **- səmalar, yer və onlarda olan** (bütün məxluqat) **Allah-Təalanı zikr edib** (Onu pak və müqəddəs sayırlar. Məxluqatın varlığı onun Allah-Təalanı zikr edib müqəddəs sayması deməkdir)**.** (وَاِنْ مِنْ شَيْءٍ اِلَّا يُسَبِّحُ بِحَمْدِهٖ) – (Aləmdə heyvanat, nəbatat, canlı-cansız, ağıl sahibi) **elə bir şey yoxdur ki, Allah-Təalaya** (ya dili ilə, ya da halları ilə) **həmd-səna edib** (Onu hər bir eyib və nöqsandan pak, müqəddəs saymasın)**.** (وَلٰكِنْ لَا تَفْقَهُونَ تَسْبِيحَهُمْ) – (bütün aləm Allah-Təalaya həmd-səna edir)**, amma siz onların zikr etməsini** (həmd-sənasını) **anlamırsınız,** (sizdə o diqqətli nəzər yoxdur ki, hər bir şeyin həqiqətinə baxıb, onların həmd-səna etməsini və tövhidə işarə etdiyini görəsiniz. Hər zərrə onun birliyi və şərikinin olmadığını göstərir)**.** (اِنَّهُ كَانَ حَلِيمًا غَفُورًا) **- həqiqətən,** (Allah-Təala ondan qafil və cahil olub ona şərik qoşmanıza görə, sizə əzab etməkdə tələsməz)**, O, tövbə edənləri bağışlayandır.**

**45)** (وَاِذَا قَرَأْتَ الْقُرْاٰنَ) **-** (ey Məhəmməd)**, sən Quran oxuyub** (xalqı Allah-Təalanın tərəfinə və Quranın ehkamına dəvət etdikdə, müşriklər qulaq asmazlar)**.** (جَعَلْنَا بَيْنَكَ وَبَيْنَ الَّذِينَ لَا يُؤْمِنُونَ بِالْاٰخِرَةِ حِجَابًا مَسْتُورًا) – (sən Quran oxuduqda)**, səninlə axirətə iman gətirməyənlərin arasında** (öz dediklərinə görə) **görünməz bir pərdə çəkərik.** (Onlar daha Quranı dərk edib ondan faydalana

وَجَعَلْنَا عَلٰى قُلُوبِهِمْ اَكِنَّةً اَنْ يَفْقَهُوهُ وَفٖي اٰذَانِهِمْ وَقْرًاۜ وَاِذَا ذَكَرْتَ رَبَّكَ فِي الْقُرْاٰنِ وَحْدَهُ وَلَّوْا عَلٰٓى اَدْبَارِهِمْ نُفُورًا ﴿٤٦﴾ نَحْنُ اَعْلَمُ بِمَا يَسْتَمِعُونَ بِهٖٓ اِذْ يَسْتَمِعُونَ اِلَيْكَ وَاِذْ هُمْ نَجْوٰٓى اِذْ يَقُولُ الظَّالِمُونَ اِنْ تَتَّبِعُونَ اِلَّا رَجُلًا مَسْحُورًا ﴿٤٧﴾ اُنْظُرْ كَيْفَ ضَرَبُوا لَكَ الْاَمْثَالَ فَضَلُّوا فَلَا يَسْتَطٖيعُونَ سَبٖيلًا ﴿٤٨﴾ وَقَالُوٓا ءَاِذَا كُنَّا عِظَامًا وَرُفَاتًا ءَاِنَّا لَمَبْعُوثُونَ خَلْقًا جَدٖيدًا ﴿٤٩﴾

---

bilməzlər. Hz. Peyğəmbər müşrikləri tövhidə dəvət etdikdə, deyirdilər ki, bizimlə sənin aranda pərdə var)**.**

**46)** (وَجَعَلْنَا عَلٰى قُلُوبِهِمْ اَكِنَّةً اَنْ يَفْقَهُوهُ) – (müşriklər özləri deyirdilər ki, qəlbimiz pərdə içindədir, bu Qurandan bir şey dərk edə bilmərik)**, onların qəlblərinə pərdələr çəkdik ki,** (Quranı) **anlayıb dərk etməsinlər.** (وَفٖي اٰذَانِهِمْ وَقْرًا) – (yenə müşriklər deyirdilər ki, ey Məhəmməd, bizim qulağımız kardır, sən deyən sözləri eşitmirik)**, qulaqlarına ağırlıq** (karlıq) **verdik ki,** (Quranın kəlmələrini eşitməsinlər)**.** (وَاِذَا ذَكَرْتَ رَبَّكَ فِي الْقُرْاٰنِ وَحْدَهُ) **-** (ey Məhəmməd)**, Qurani-Şərifdə rəbbini tək bir Allah-Təala olaraq zikr edib** (onların bütlərini tərk etdiyində)**,** (وَلَّوْا عَلٰٓى اَدْبَارِهِمْ نُفُورًا) **– səndən nifrətlə üz çevirib geri qayıdarlar.** (Çünki onların bütlərini rəbbin Allah-Təala ilə birlikdə zikr etmirsən)**.**

**47)** (نَحْنُ اَعْلَمُ بِمَا يَسْتَمِعُونَ بِهٖٓ اِذْ يَسْتَمِعُونَ اِلَيْكَ) **-** (sən Quran oxuyub müşriklər də guya) **sənə qulaq asdıqda, biz bilirik ki, onlar nəyə qulaq asırlar,** (onlar sənə qulaq asmırlar, bəlkə, sən Quran oxuyanda sənə istehza edib boş-boş danışanlara qulaq asırlar. Hz. Peyğəmbər Məkkədə Quran oxuyub xalqı dəvət edəndə, bəni-Əbdüd-Dar camaatından iki nəfər o cənabın sağ tərəfində, iki nəfər də sol tərəfində durub əl çalıb şeir oxuyardılar ki, xalq peyğəmbərin oxuduğu Qurani-Şərif ayələrini eşitməsinlər)**.** (وَاِذْ هُمْ نَجْوٰٓى اِذْ يَقُولُ الظَّالِمُونَ اِنْ تَتَّبِعُونَ اِلَّا رَجُلًا مَسْحُورًا) **-** (ey Məhəmməd)**, biz onların bir-biriləri ilə gizlin danışıb, zalımların** (Vəlid ibn Müğirə və ona tabe olanların) **dediyi – siz ancaq sehirlənmiş** (dəli) **bir şəxsə** (Məhəmmədə əs.,) **tabe olursunuz – sözünə də agahıq.**

**48)** (اُنْظُرْ كَيْفَ ضَرَبُوا لَكَ الْاَمْثَالَ) **-** (ey Məhəmməd)**, bax gör ki,** (bu axmaq olan Qüreyş tayfası) **səndən ötrü nə məsəllər zikr edirlər.** (Gah sənə dəli və sehirbaz, gah şair, gah da kahin deyirlər, halbuki bu sifətlərin heç birini səndə görmürlər)**.** (فَضَلُّوا فَلَا يَسْتَطٖيعُونَ سَبٖيلًا) – (bu məsəllərin hamısında) **zəlalətə düşüb haqq yolu tapmağa qadir olmayıblar.** (Ona görə də zəlalət vadisində çaşqın və sərgərdan qalıblar)**.**

**49)** (وَقَالُوٓا ءَاِذَا كُنَّا عِظَامًا وَرُفَاتًا) **-** (ey Məhəmməd, müşriklər) **dedilər: "Biz** (öləndən sonra ətimiz tökülüb) **sür-sümük və çürüyüb ovxalanmış** (torpaq) **olandan sonra** (ءَاِنَّا لَمَبْعُوثُونَ خَلْقًا جَدٖيدًا) **- dirildilib təzədən məxluq olacağıq?"**

قُلْ كُونُوا حِجَارَةً اَوْ حَدِيدًاۙ ﴿٥٠﴾ اَوْ خَلْقًا مِمَّا يَكْبُرُ فِي صُدُورِكُمْۚ فَسَيَقُولُونَ مَنْ يُعِيدُنَاۜ قُلِ
الَّذِي فَطَرَكُمْ اَوَّلَ مَرَّةٍۚ فَسَيُنْغِضُونَ اِلَيْكَ رُؤُسَهُمْ وَيَقُولُونَ مَتٰى هُوَۜ قُلْ عَسٰٓى اَنْ يَكُونَ قَرِيبًا
﴿٥١﴾ يَوْمَ يَدْعُوكُمْ فَتَسْتَجِيبُونَ بِحَمْدِهٖ وَتَظُنُّونَ اِنْ لَبِثْتُمْ اِلَّا قَلِيلًا ﴿٥٢﴾ وَقُلْ لِعِبَادِي يَقُولُوا
الَّتِي هِيَ اَحْسَنُۜ اِنَّ الشَّيْطَانَ يَنْزَغُ بَيْنَهُمْۜ اِنَّ الشَّيْطَانَ كَانَ لِلْاِنْسَانِ عَدُوًّا مُبِينًا ﴿٥٣﴾

---

(Müşriklər dirilməyə inanmayıb ağıla zidd saydıqları üçün Allah-Təala gələn ayədə onların iddiasını rədd edir).

**50-51)** (قُلْ كُونُوا حِجَارَةً اَوْ حَدِيدًا) - (ey Məhəmməd, onların cavabında) **de ki,** (öləndən sonra) **daş, ya da dəmir kimi möhkəm olun,** (اَوْ خَلْقًا مِمَّا يَكْبُرُ فِي صُدُورِكُمْ) **- ya da qəlbinizdə** (özünüzü hamıdan) **böyük məxluq sayın,** (yenə sizi diriltməyə qüdrətimiz var)**.** (فَسَيَقُولُونَ مَنْ يُعِيدُنَا) - (ey Məhəmməd)**, sənə deyirlər ki, bizi kim** (dirildib həyata) **qaytaracaqdır?** (قُلِ الَّذِي فَطَرَكُمْ اَوَّلَ مَرَّةٍ) **-** (ey Məhəmməd, onlara) **de ki, sizi ilk dəfə yoxdan yaradan diriləcək.** (İlk dəfə Adəmi yaradanda heç bir əzası yox idi, sizi təkrar həyata qaytaranda isə sümüyünüz, ya da başqa bir şey olacaqdır. İlk yaradılışa qadir olan ikinci yaradılışa, diriltməyə də qadirdir)**.** (فَسَيُنْغِضُونَ اِلَيْكَ رُؤُسَهُمْ) - (ey Məhəmməd, sən bu sözü onlara deyəndə təəccüb və istehza ilə) **sənə başlarını bulayarlar** (yəni bu nə söz danışır?) (وَيَقُولُونَ مَتٰى هُوَ) – (yenə istehza ilə deyərlər: "Qiyamət günü) **nə vaxt olacaqdır?** (ki, biz öləndən sonra təzədən dirilək)**.** (قُلْ عَسٰى اَنْ يَكُونَ قَرِيبًا) **-** (ey Məhəmməd, onların cavabında) **de ki, ümidvarıq ki, o** (gün) **yaxındır,** (hərçənd siz onu uzaq hesab edirsiniz)**.**

**52)** (يَوْمَ يَدْعُوكُمْ فَتَسْتَجِيبُونَ بِحَمْدِهٖ) **- o gün** (qiyamət günü Allah-Təala qəbirlərinizdən) **sizi çağırar,** (siz də Allah-Təalanın) **dəvətini qəbul edib ona həmd edən halda** (həyat tapıb qəbirdən çıxarsınız. O məqamda heç kim Allah-Təalanın itaətindən çıxa bilməz)**.** (وَتَظُنُّونَ اِنْ لَبِثْتُمْ اِلَّا قَلِيلًا) – (qiyamət gününün dəhşət və əzabını görəndən sonra dünyada qaldığınız müddəti az sayıb) **güman edərsiniz ki,** (orada) **az bir zaman qalıbsınız,** (dünya gözünüzdə həqir olub peşman olarsınız ki, niyə o dünyada xeyir əməl etməyib peyğəmbərə, Qurana iman gətirmədik?)**.**

**53)** (وَقُلْ لِعِبَادِي يَقُولُوا الَّتِي هِيَ اَحْسَنُ) - (ey Məhəmməd, mömin olan) **bəndələrimə de ki,** (müşrikləri islama dəvət etdikdə, onlara) **yaxşı və gözəl sözlər deyib** (nəsihət etsinlər)**.** (اِنَّ الشَّيْطَانَ يَنْزَغُ بَيْنَهُمْ) **- həqiqətən, şeytan onların arasına fitnə-fəsad salır,** (şeytanın vəsvəsəsinə baxmayıb müşriklərlə səbirlə rəftar etsinlər)**.** (اِنَّ الشَّيْطَانَ كَانَ لِلْاِنْسَانِ عَدُوًّا مُبِينًا)**- həqiqətən, şeytan insanın açıq-aşkar düşmənidir.** (Ona itaət etməyib müşriklərlə xoş rəftar etsinlər ki, bəlkə, islama meyil edib müsəlman olsunlar)**.**

رَبُّكُمْ اَعْلَمُ بِكُمْۜ اِنْ يَشَأْ يَرْحَمْكُمْ اَوْ اِنْ يَشَأْ يُعَذِّبْكُمْۜ وَمَٓا اَرْسَلْنَاكَ عَلَيْهِمْ وَكِيلًا ﴿٥٤﴾ وَرَبُّكَ
اَعْلَمُ بِمَنْ فِي السَّمٰوَاتِ وَالْاَرْضِۜ وَلَقَدْ فَضَّلْنَا بَعْضَ النَّبِيِّنَ عَلٰى بَعْضٍ وَاٰتَيْنَا دَاوُدَ زَبُورًا ﴿٥٥﴾
قُلِ ادْعُوا الَّذٖينَ زَعَمْتُمْ مِنْ دُونِهٖ فَلَا يَمْلِكُونَ كَشْفَ الضُّرِّ عَنْكُمْ وَلَا تَحْوٖيلًا ﴿٥٦﴾ اُولٰٓئِكَ الَّذٖينَ
يَدْعُونَ يَبْتَغُونَ اِلٰى رَبِّهِمُ الْوَسٖيلَةَ اَيُّهُمْ اَقْرَبُ وَيَرْجُونَ رَحْمَتَهُ وَيَخَافُونَ عَذَابَهُۜ

---

**54)** (رَبُّكُمْ اَعْلَمُ بِكُمْ) – (möminlər müşriklərə belə desinlər: “Ey müşriklər)**, rəbbiniz Allah-Təala sizi sizdən yaxşı bilir.** (اِنْ يَشَأْ يَرْحَمْكُمْ اَوْ اِنْ يَشَأْ يُعَذِّبْكُمْ) - **əgər Allah-Təala istəsə, sizə rəhm edib bağışlayar, ya da istəsə, əzab edər.”** (Müşriklərə belə desinlər, daha deməsinlər ki, siz cəhənnəm əhli olub əzab çəkəcəksiniz, belə sözlərdən xoşlanmayıb islama nifrət edər, müsəlman olmazlar. Əlbəttə onların işləri Allah-Təalanın ixtiyarındadır. Ey Məhəmməd, onların aqibətinin sənə də dəxli yoxdur)**,** (وَمَٓا اَرْسَلْنَاكَ عَلَيْهِمْ وَكٖيلًا)- (ey Məhəmməd)**, səni onların** (işlərinə) **vəkil göndərməmişik,** (onların ixtiyarı səndə deyil ki, onları zorla islama daxil edəsən. Səni ancaq müjdələyən və qorxudan olaraq göndərmişik, müşriklərlə səbirlə rəftar edib onların əziyyətlərinə dözün)**.**

**55)** (وَرَبُّكَ اَعْلَمُ بِمَنْ فِي السَّمٰوَاتِ وَالْاَرْضِ) - (ey Məhəmməd)**, sənin rəbbin Allah-Təala səmalarda və yerdə olan məxluqata** (onların əhvalına və sayına, əməllərinə, kim peyğəmbər olmağa layiqdir, ya yox, bu şeylərin hamısına agah olub, layiq olan şəxsi aranızdan seçib sizə peyğəmbər göndərib)**.** (وَلَقَدْ فَضَّلْنَا بَعْضَ النَّبِيّٖنَ عَلٰى بَعْضٍ) – (bu səbəbdən) **peyğəmbərlərin bəzisini digərlərinə üstün edib** (dərəcəsini artırdıq. Uca peyğəmbərimizin Qurani-Şərifdə sair peyğəmbərlərə üstünlüyünün qeyd olunması Qurani-Şərifin Allah-Təaladan olduğuna işarədir)**.** (وَاٰتَيْنَا دَاوُدَ زَبُورًا) – **Davud** (peyğəmbərə) **Zəbur** (kimi kitab) **verdik.** (O kitabda Allah-Təalanın həmd-sənasını və duaları ehtiva edən ayələr qeyd olunubdur)**.**

**56)** (قُلِ ادْعُوا الَّذٖينَ زَعَمْتُمْ مِنْ دُونِهٖ) – (Məkkə əhli aclığa, qıtlığa düçar olduqda, gəlib Hz. Peyğəmbərə yalvardılar ki, dua et, Allah-Təala bu bəlanı bizdən dəf etsin)**. Onlara de ki,** (Allah-Təaladan) **başqa məbud güman etdiklərinizə** (kömək üçün dua edib) **çağırın,** (görün sizə kömək olub bu bəlanı sizdən dəf edə bilirlərmi?) (فَلَا يَمْلِكُونَ كَشْفَ الضُّرِّ عَنْكُمْ وَلَا تَحْوٖيلًا)– (bütlər heç vaxt) **bu bəlanı sizdən dəf etməyə, nə də dəyişdirib** (sizdən sovuşdurub, bir başqasına tərəf yönəltməyə qadir olmayıb heç bir şeyə malik deyillər)**.**

**57)** (اُولٰٓئِكَ الَّذٖينَ يَدْعُونَ) – (müşriklərin Allah-Təaladan başqa) **dua edib ibadət etdikləri** (bu məbudlar - mələklər və peyğəmbərlər)**,** (يَبْتَغُونَ اِلٰى رَبِّهِمُ الْوَسٖيلَةَ اَيُّهُمْ اَقْرَبُ) **- özləri Allah-Təalaya yaxın olmaq üçün bir vəsilə axtarırlar,** (وَيَرْجُونَ رَحْمَتَهُ وَيَخَافُونَ عَذَابَهُ) – (özləri Allah-Təalanın) **rəhmətinə ümid edib, Onun əzabından qorxurlar,** (ibadət etdikləri məbudların halı belə olanda

اِنَّ عَذَابَ رَبِّكَ كَانَ مَحْذُورًا ﴿٥٧﴾ وَاِنْ مِنْ قَرْيَةٍ اِلَّا نَحْنُ مُهْلِكُوهَا قَبْلَ يَوْمِ الْقِيٰمَةِ اَوْ مُعَذِّبُوهَا
عَذَابًا شَدِيدًاۜ كَانَ ذٰلِكَ فِي الْكِتَابِ مَسْطُورًا ﴿٥٨﴾ وَمَا مَنَعَنَٓا اَنْ نُرْسِلَ بِالْاٰيَاتِ اِلَّٓا اَنْ كَذَّبَ بِهَا
الْاَوَّلُونَۜ وَاٰتَيْنَا ثَمُودَ النَّاقَةَ مُبْصِرَةً فَظَلَمُوا بِهَاۜ وَمَا نُرْسِلُ بِالْاٰيَاتِ اِلَّا تَخْوِيفًا ﴿٥٩﴾

---

necə olur ki, Allah-Təalanı qoyub o məbudlara sitayiş etsinlər? Hansı ki onlar özləri Allaha sitayiş edirlər). (اِنَّ عَذَابَ رَبِّكَ كَانَ مَحْذُورًا) - (ey Məhəmməd)**, həqiqətən, rəbbin Allah-Təalanın əzabı ondan qorxulmağa** (layiqdır. Hamı, mələklər və peyğəmbərlər də gərək, Ondan qorxsunlar)**.**

**58)** (وَاِنْ مِنْ قَرْيَةٍ اِلَّا نَحْنُ مُهْلِكُوهَا قَبْلَ يَوْمِ الْقِيٰمَةِ اَوْ مُعَذِّبُوهَا عَذَابًا شَدِيدًا) **– elə bir məmləkət olmaz ki, biz qiyamət günündən qabaq onların** (əhalisini - möminləri öz əcəlləriylə, kafirləri və asiləri əzab göndərməklə) **həlak etməyək.** (كَانَ ذٰلِكَ فِي الْكِتَابِ مَسْطُورًا) **- bu** (qeyd olunan hökm Lövhi-məhfuzda - ilahi elmin qeyd olunduğu) **kitabda yazılıb** (dəyişən deyil. Necə ki qeyd olunub, elə də olacaq)**.**

**59)** (وَمَا مَنَعَنَٓا اَنْ نُرْسِلَ بِالْاٰيَاتِ اِلَّٓا اَنْ كَذَّبَ بِهَا الْاَوَّلُونَ) **-** (Qüreyş camaatı Məkkədə Hz. peyğəmbərdən Qurandan başqa möcüzə istədilər. Necə ki bundan sonra qeyd olunacaqdır. Hz. Peyğəmbər buyurubdur: “Mən şəbədəbaz deyiləm ki, məndə olmayan şeyləri sizə gətirim, möcüzə Allah-Təalanın ixtiyarındadır. Əgər istəsə verər”, ayədə Allah-Təala onların istədiyi möcüzələri verməməsinin səbəbini belə izah edir: Qüreyşin istədiyi) **möcüzələri göndərməkdə bizə mane olan şey ancaq onlardan əvvəlki** (qövmlərə göndərdiyimiz möcüzələri qəbul etməyib) **yalanlamaları idi,** (bu səbəbdən onlara əzab göndərdik, bunlar da əvvəlki ümmətlər kimi möcüzəni qəbul etməyib inkar edəcəklər, inkar edəndən sonra, gərək, onlara əzab göndərib hamısını həlak edəydik. Allah-Təalanın adəti belədir ki, peyğəmbərdən möcüzə istəyən qövmə Allah-Təala o peyğəmbərin vasitəsilə möcüzə göndərər. Amma əgər o qövm iman gətirməsə, Lut, Şüeyb, Ad, Səmud qövmləri kimi onlara yox edici əzab göndərib hamısını həlak edər. Allah-Təala Hz. Məhəmməd ibn Abdullahı (ə.s), aləmlərə rəhmət olaraq göndərdiyindən Qüreyşin istədiyi möcüzələri onlara göndərmədi. Belə ki, iman gətirməyəndən sonra onlara əzab göndərib həlak etməsin)**.** (وَاٰتَيْنَا ثَمُودَ النَّاقَةَ مُبْصِرَةً) **–** (göndərdiyimiz möcüzələrə iman gətirməyən qövmlərdən biri də Səmud camaatıdır. Saleh peyğəmbərin haqq olduğunu göstərməkdən ötrü) **Səmud** (qövmünə) **açıq-aşkar dəlil olan dişi bir dəvə verdik.** (فَظَلَمُوا بِهَا)**–** (o möcüzəyə iman gətirməyib kafir olub)**, zülm edib** (dəvəni öldürdülər. Buna görə də onlara əzab gəlib hamısı həlak oldu)**.** (وَمَا نُرْسِلُ بِالْاٰيَاتِ اِلَّا تَخْوِيفًا) **– biz** (haqq olan) **möcüzələri ancaq əzabdan qorxub** (iman gətirsinlər deyə) **göndərərik,** (ancaq qorxub iman gətirməsələr, o vaxt da onlara əzab edərik)**.**

وَاِذْ قُلْنَا لَكَ اِنَّ رَبَّكَ اَحَاطَ بِالنَّاسِ وَمَا جَعَلْنَا الرُّءْيَا الَّتِي اَرَيْنَاكَ اِلَّا فِتْنَةً لِلنَّاسِ وَالشَّجَرَةَ الْمَلْعُونَةَ فِي الْقُرْاٰنِ وَنُخَوِّفُهُمْ فَمَا يَزِيدُهُمْ اِلَّا طُغْيَانًا كَبِيرًا ﴿٦٠﴾ وَاِذْ قُلْنَا لِلْمَلٰٓئِكَةِ اسْجُدُوا لِاٰدَمَ فَسَجَدُوٓا اِلَّٓا اِبْلِيسَ

---

**60)** (وَاِذْ قُلْنَا لَكَ اِنَّ رَبَّكَ اَحَاطَ بِالنَّاسِ) - (ey Məhəmməd)**, bir zaman sənə demişdik ki, həqiqətən, sənin rəbbin Allah-Təala bütün insanları ehtiva edib** (heç kim onun qüdrətinə tabe olmaqdan kənar ola bilməz. Bədir günündə Qüreyş camaatının zəlil olub öldürüləcəyini Allah-Təala Hz. Peyğəmbərə xəbər verib, onların Bədir çölündə öləcəyi yeri bir-bir Hz. Peyğəmbərə yuxuda bildirdi. Hz. Peyğəmbər bu xəbəri Məkkədə Qüreyş camaatına bildirəndə ona istehza edib öz məclislərində danışıb gülürdülər, necə ki Allah-Təala bu ayədə xəbər verir)**.** (وَمَا جَعَلْنَا الرُّءْيَا الَّتِي اَرَيْنَاكَ اِلَّا فِتْنَةً لِلنَّاسِ) - (ey Məhəmməd)**, sənə** (Qüreyş barəsində) **göstərdiyimiz yuxunu insanlardan ötrü** (fitnə və) **imtahan etdik** (ki, görək sənin yuxunu təsdiq edirlər, yoxsa yox? Lakin təsdiq etməyib, fitnə-fəsad edib sənə istehza edirlər.) (وَالشَّجَرَةَ الْمَلْعُونَةَ فِي الْقُرْاٰنِ) – **və** (cəhənnəmdə yeyilən) **ağaca da** (zəqqum ağacını yeyənlərə də)* **Quranda lənət olunubdur,** (onu da insanlardan ötrü fitnə və imtahan etdik ki, görək, sənin sözünü təsdiq edirlər, yoxsa yox? Lakin təsdiq etməyib o ağaca görə də sənə istehza edirlər. Hz. Peyğəmbər Qüreyş camaatına xəbər verəndə ki, cəhənnəmdə günahkarların yeməyi zəqqum ağacının meyvəsidir. Çox təəccüb etdilər, necə olur ki, atəşin içində ağac olsun. Bu sözü hər məclisdə danışıb istehza edib gülürdülər (Buxari, Təfsiru Surə 9))**.** (وَنُخَوِّفُهُمْ) - (ey Məhəmməd, dünya və axirət əzabını onlara vəd etməklə) **onları qorxuduruq ki,** (bəlkə imana daxil olsunlar)**.** (فَمَا يَزِيدُهُمْ اِلَّا طُغْيَانًا كَبِيرًا) – (bizim qorxutmağımız onların asiliyini daha da artırıb zəlalətdə qalmalarına səbəb olubdur. Bir qövm və camaat ki, onların halı belə olsun, onlara möcüzə təsir etməyib itaətə gələn deyillər. Buna görə də onların istədiyi möcüzələri göndərmək bizə lazım deyildir. Onların istədikləri möcüzələrin təfsilatı bundan sonra bu surədə qeyd olunacaqdır)**.**

*(*Qeyd: Zəqqum Ərəbistanda bitən, meyvəsi zəhərli olan bir ağacdır).*

**61)** (وَاِذْ قُلْنَا لِلْمَلٰٓئِكَةِ اسْجُدُوا لِاٰدَمَ فَسَجَدُوٓا اِلَّٓا اِبْلِيسَ) - (ey Məhəmməd)**, mələklərə - Adəmə səcdə edin, dedikdə İblisdən** (şeytandan) **başqa** (hamısı) **səcdə etdi.** (Şeytanın Adəmə səcdə etməməsini burada qeyd etməkdə məqsəd şeytanın Allah-Təalanın möcüzələrini Adəmin və özünün yoxdan yaradılışını müşahidə etdiyi halda, Allah-Təalaya itaət etməyib, asi olub, Adəmin səcdəsinə əmr olunan mələklərin cərgəsindən kənar olunması qissəsini, habelə möcüzə istəyən Qüreyş camaatının Hz. Peyğəmbər kimi elm, fəzilət, zahiri və mənəvi mükəmməlliyə sahib olan bir şəxsin varlığında, özlərinin və kainatın yaradılışındakı möcüzələri görməyib, Allah-Təalaya şirk qoşub, Onun itaətindən çıxıb

قَالَ ءَاَسْجُدُ لِمَنْ خَلَقْتَ طِينًاۚ ﴿٦١﴾ قَالَ اَرَاَيْتَكَ هٰذَا الَّذ۪ي كَرَّمْتَ عَلَيَّۘ لَئِنْ اَخَّرْتَنِ اِلٰى يَوْمِ
الْقِيٰمَةِ لَاَحْتَنِكَنَّ ذُرِّيَّتَهُٓ اِلَّا قَل۪يلًا ﴿٦٢﴾ قَالَ اذْهَبْ فَمَنْ تَبِعَكَ مِنْهُمْ فَاِنَّ جَهَنَّمَ جَزَٓاؤُ۬كُمْ جَزَٓاءً
مَوْفُورًا ﴿٦٣﴾ وَاسْتَفْزِزْ مَنِ اسْتَطَعْتَ مِنْهُمْ بِصَوْتِكَ وَاَجْلِبْ عَلَيْهِمْ بِخَيْلِكَ وَرَجِلِكَ وَشَارِكْهُمْ
فِي الْاَمْوَالِ وَالْاَوْلَادِ وَعِدْهُمْۜ

---

kafir olduqlarını bəyan etməkdir). (قَالَ ءَاَسْجُدُ لِمَنْ خَلَقْتَ طِينًا) – (Allah-Təaladan ona xitab gəldi ki, ey İblis, niyə Adəmə səcdə etmədin?) **Dedi: “Bəs mən palçıqdan yaratdığın şəxsə səcdə edərəmmi?** (Bu imkansız bir şeydir)**.**

**62)** (قَالَ اَرَاَيْتَكَ هٰذَا الَّذ۪ي كَرَّمْتَ عَلَيَّ) **-** (İblis) **dedi:** (ilahi), **mənə üstün edib,** (əziz saydığın) **bu** (Adəmi, bunun səbəbini) **mənə xəbər ver,** (لَئِنْ اَخَّرْتَنِ اِلٰى يَوْمِ الْقِيٰمَةِ) **-** (Allah-Təalanın düşməni olan İblis səbir etmədi ki, sualına cavab verilsin, dedi: “Əgər mənə uzun ömür verib) **qiyamət gününə kimi mənə möhlət versən,** (لَاَحْتَنِكَنَّ ذُرِّيَّتَهُٓ اِلَّا قَل۪يلًا) **- əlbəttə** (Adəmin) **nəslini zəlalətə salıb** (hamısını əzaba düçar edib həlak edəcəyəm)**. Ancaq az bir qismi** (ixlaslı bəndələrin) **istisnadır,** (onlara mənim vəsvəsəm təsir etməz)**.”**

**63)** (قَالَ اذْهَبْ) – (Allah-Təala) **dedi: “**(ey İblis)**, get,** (seçdiyin yola davam et)**.** (فَمَنْ تَبِعَكَ مِنْهُمْ) – (Adəm övladından) **sənə kim tabe olsa,** (فَاِنَّ جَهَنَّمَ جَزَٓاؤُ۬كُمْ جَزَٓاءً مَوْفُورًا) **- həqiqətən, sənin və sənə tabe olanların cəzası mükəmməl bir cəza olan cəhənnəmdir.**

**64)** (وَاسْتَفْزِزْ مَنِ اسْتَطَعْتَ مِنْهُمْ بِصَوْتِكَ) – **onlardan** (Adəm övladından) **kimə gücün çatırsa, səsləyib** (günaha) **çağır,** (وَاَجْلِبْ عَلَيْهِمْ بِخَيْلِكَ وَرَجِلِكَ) – **atlı və piyada** (qoşunlar kimi) **onların üzərinə saldır.** (Bu kəlam şeytanın Adəm övladına hakim olmasına işarədir. Şeytanın Adəm övladına hakim olub onları öz istədiyi kimi işlətməsi məsəli ərəblərin arasında adət olan qarətçiliyə - bir qəbilənin rəisinin atlı və piyada qoşununu toplayıb sübh çağı qəflətən ucadan səs salıb başqa bir qəbiləyə hücum edib, onları qarət etməsinə işarədir. Yəni sən də ey şeytan, qoşununu götürüb Adəm övladını qarət et. Amma mənim ixlaslı bəndələrimə heç vaxt hakim ola bilməzsən)**.** (وَشَارِكْهُمْ فِي الْاَمْوَالِ وَالْاَوْلَادِ) **-** (ey İblis)**, onların mallarında və övladlarında şərik ol.*** (وَعِدْهُمْ) – (ey şeytan)**, onlara** (yalan) **vəd verib,** (aldat)**.****

*(***Qeyd:** İnsanın mal və övlad barəsində olan hər bir günahına şeytan şərikdir. Malda olan günahlar - məsələn, nəcis şeylərin alış-verişin etmək və ya yemək, günah yolda mal sərf edib israf etmək, zəkat və sədəqə verməməkdir. Övlad barəsində olan günahlar - zinadan övlad dünyaya gətirmək, ya da süd qohumluğu səbəbilə bir-birilərinə haram olanların ər-arvad olub övlad dünyaya gətirməsi, ya da bir qadınla zina edəndən sonra onların bacılarını alıb ondan övladın olması, ya da övlada Allah-Təalanın razı olmadığı adları qoymaq, məsələn, bu dövrdə də camaatın arasında yay-*

**وَمَا يَعِدُهُمُ الشَّيْطَانُ اِلَّا غُرُورًا ﴿٦٤﴾ اِنَّ عِبَادِي لَيْسَ لَكَ عَلَيْهِمْ سُلْطَانٌ وَكَفٰى بِرَبِّكَ وَكِيلًا**
**﴿٦٥﴾ رَبُّكُمُ الَّذِي يُزْجِي لَكُمُ الْفُلْكَ فِي الْبَحْرِ لِتَبْتَغُوا مِنْ فَضْلِهِ اِنَّهُ كَانَ بِكُمْ رَحِيمًا ﴿٦٦﴾**

---

*ğın olan adlar qoymaq və s. Məkkə bütü olan Manafa nisbətlə Əbdül-Manaf, Əbdül-Müttəlib, Əbdül-Haşim, Əbdül-Məhəmməd, Əbdül-Əla, Əbdül-Həsən, Əbdül-Hüseyn kimi adlar qoymaq günahdır. Allah-Təaladan başqa heç kimə qul olmaq caiz olmadığından bu adları qoymaq da caiz deyildir. Əbd (qul) sözünü ancaq Allah-Təalanın adları ilə birlikdə işlətmək caizdir, Abdullah, Əbdürrəhman, Əbdürrəhim, Əbdül-Hilm, Əbdül-Kərim və s. kimi, amma Allahın adlarını da əbd (qul) söz olmadan təkcə qoymaq caiz deyildir).*

*(****Qeyd:** bütlərin şəfaət etməsi və bütlərin Allah-Təala yanında hörməti olduğuna inanmaq və ya peyğəmbər, imam nəslindən olmaqla qürurlanmaq, böyük günahlarda peyğəmbərin şəfaətinə inanmaq, fasiq, günahkar şəxsləri imamların yanında dəfn edib onları Allah-Təalanın intiqamından qoruyub şəfaət edəcəyinə inanmaq, ya da onların müsibətlərinə ağlamaqla böyük günahlarının silinəcəyinə inanmaq, çürümüş sümüklərini uzaq ölkələrdən gətirib imamların yanında dəfn etməklə əbədi nicat tapacaqlarına etiqad etmək, tövbə edilmədən böyük günahların bağışlanacağına inanmaq, itaət və ibadəti, hər bir xeyir əməli tərk edib Allah-Təalanın rəhminə ümidvar olmaq və s., bunların hamısı şeytanın vədi və vəsvəsəsidir. Gərək, bu vədlərə aldanmayıb Allah-Təalanın vədinə inanaq).*

(وَمَا يَعِدُهُمُ الشَّيْطَانُ اِلَّا غُرُورًا) – (bunların hamısı şeytanın yalan vədləridir)**. Şeytan** (Adəm övladına) **ancaq aldadıcı vəd** (batili haqq surətində gözəl göstərən vəd) **verər.**

**65)** (اِنَّ عِبَادِي لَيْسَ لَكَ عَلَيْهِمْ سُلْطَانٌ) - (ey İblis)**, həqiqətən,** (mənə itaət edən ixlaslı) **bəndələrim üzərində sənin heç bir hökmün yoxdur.** (Onlar sənə itaət etməzlər)**.** (وَكَفٰى بِرَبِّكَ وَكِيلًا) **- rəbbin Allah-Təala** (ixlaslı bəndələrinə) **vəkil olaraq kifayət edər.** (Onlar hər bir işlərində Allah-Təalaya təvəkkül edib, Ona pənah aparıb, sən onları asi edib zəlalətə sala bilməzsən. Bundan sonra gələn ayələrdə Allah-Təala öz qüdrət və səltənətini, nemət və lütfünü bəndələrinə bəyan edir)**.**

**66)** (رَبُّكُمُ الَّذِي يُزْجِي لَكُمُ الْفُلْكَ فِي الْبَحْرِ لِتَبْتَغُوا مِنْ فَضْلِهِ) – (ey insan övladı)**, rəbbiniz Allah-Təala onun lütf və rəhmətinə nail olub** (ruzi qazanasınız deyə, öz kamil qüdrəti ilə) **gəmiləri sizin üçün dənizdə üzdürər.** (İnsan övladının ağlı Allah-Təalanın ona bir lütfü olduğundan insan əməli olan yelkən və buxarı, gəmiçilik sənətini və gəmilərin dənizdə üzməsini Allah-Təala özünə isnad edir)**.** (اِنَّهُ كَانَ بِكُمْ رَحِيمًا) **- həqiqətən, Allah-Təala sizə rəhm edib,** (hər bir xeyir və mənfəətin yolunu sizdən ötrü asan edibdir)**.**

وَاِذَا مَسَّكُمُ الضُّرُّ فِي الْبَحْرِ ضَلَّ مَنْ تَدْعُونَ اِلَّا اِيَّاهُۚ فَلَمَّا نَجّٰيكُمْ اِلَى الْبَرِّ اَعْرَضْتُمْۜ وَكَانَ الْاِنْسَانُ كَفُورًا ﴿٦٧﴾ اَفَاَمِنْتُمْ اَنْ يَخْسِفَ بِكُمْ جَانِبَ الْبَرِّ اَوْ يُرْسِلَ عَلَيْكُمْ حَاصِبًا ثُمَّ لَا تَجِدُوا لَكُمْ وَكِيلًاۙ ﴿٦٨﴾ اَمْ اَمِنْتُمْ اَنْ يُعِيدَكُمْ فِيهِ تَارَةً اُخْرٰى فَيُرْسِلَ عَلَيْكُمْ قَاصِفًا مِنَ الرِّيحِ فَيُغْرِقَكُمْ بِمَا كَفَرْتُمْۙ ثُمَّ لَا تَجِدُوا لَكُمْ عَلَيْنَا بِهِ تَبِيعًا ﴿٦٩﴾ وَلَقَدْ كَرَّمْنَا بَنِي اٰدَمَ وَحَمَلْنَاهُمْ فِي الْبَرِّ وَالْبَحْرِ وَرَزَقْنَاهُمْ مِنَ الطَّيِّبَاتِ وَفَضَّلْنَاهُمْ عَلٰى كَثِيرٍ مِمَّنْ خَلَقْنَا تَفْضِيلًا ﴿٧٠﴾

---

**67)** (وَاِذَا مَسَّكُمُ الضُّرُّ فِي الْبَحْرِ ضَلَّ مَنْ تَدْعُونَ اِلَّا اِيَّاهُ) – **nə zaman sizə dənizdə bəla yetişib** (gəminin təlatümə düşüb qərq olmasından qorxsanız, başqa vaxt) **çağırıb kömək istədiyiniz şeylərin hamısı yadınızdan çıxıb itər, ancaq Allah-Təala istisnadır,** (ancaq Onu çağırıb ondan yardım və nicat diləyərsiniz). (فَلَمَّا نَجّٰيكُمْ اِلَى الْبَرِّ اَعْرَضْتُمْ) - (Allah-Təala duanızı qəbul edib dənizdə qərq olmaqdan) **sizə nicat verib sizi quruya çıxartdıqda isə, üz çevirib** (ilahi neməti unudub, nicat tapmağınızı başqa səbəblərə isnad edərsiniz), (وَكَانَ الْاِنْسَانُ كَفُورًا) – **həqiqətən, insan** (Allah-Təalanın nemətini inkar edib) **nankorluq edəndir.**

**68)** (اَفَاَمِنْتُمْ اَنْ يَخْسِفَ بِكُمْ جَانِبَ الْبَرِّ) – **bəs** (Allah-Təalanın sizə dənizdən nicat verəndən sonra) **quruda sizi yerə qərq edib həlak etməyəcəyindən arxayınsınız?** (اَوْ يُرْسِلَ عَلَيْكُمْ حَاصِبًا) - **ya da üzərinizə daş yağdıran bir külək göndərib** (sizi həlak etməyəcəyindən əminsiniz?) (ثُمَّ لَا تَجِدُوا لَكُمْ وَكِيلًا) – (bu qeyd olunan şeylərin heç birindən arxayın deyilsiniz, Allah-Təala bu əzabları sizə göndərəndən sonra) **özünüzə bir vəkil tapmazsınız ki,** (işinizi ona həvalə edib, bu əzabları sizdən dəf etsin).

**69)** (اَمْ اَمِنْتُمْ اَنْ يُعِيدَكُمْ فِيهِ تَارَةً اُخْرٰى) - **ya da** (Allah-Təalanın) **sizi yenidən dənizə qaytarıb bəlaya düçar etməyəcəyindən arxayınsınız ki,** (فَيُرْسِلَ عَلَيْكُمْ قَاصِفًا مِنَ الرِّيحِ) – **üzərinizə şiddətli fırtına göndərməyəcək?** (فَيُغْرِقَكُمْ بِمَا كَفَرْتُمْ) – (dənizdə boğulmaqdan nicat tapmağınıza baxmayaraq) **nankorluq etdiyinizə görə sizi** (təkrar dənizdə) **qərq edib** (həlak etməyəcək?) **Heç vaxt bu bəlalardan arxayın ola bilməzsiniz.** (ثُمَّ لَا تَجِدُوا لَكُمْ عَلَيْنَا بِهِ تَبِيعًا) - (sizi qərq edəndən) **sonra** (intiqam almaq üçün) **bizi sorğu-sual edən birini də tapmazsınız.** (Allah-Təaladan kim intiqam ala bilər? Bütün aləm onun qüdrəti qarşısında aciz və məğlub olub, heç bir tərəfə qaçıb qurtula bilməz).

**70)** (وَلَقَدْ كَرَّمْنَا بَنِي اٰدَمَ) - **həqiqətən, biz Adəm övladını** (sair məxluqatın içində) **izzətli* və hörmətli etdik.** (وَحَمَلْنَاهُمْ فِي الْبَرِّ وَالْبَحْرِ) – (Adəm övladının izzətli olmasına bir nümunə budur ki,) **onları quruda və dənizdə** (müxtəlif heyvanlara və gəmiyə mindirib) **sahib etdik.** (Yəni bu şeyləri onlardan ötrü yaratdıq). (وَرَزَقْنَاهُمْ مِنَ الطَّيِّبَاتِ) – **onlara ləziz və pak şeylərdən ruzi verdik.** (وَفَضَّلْنَاهُمْ عَلٰى كَثِيرٍ مِمَّنْ خَلَقْنَا تَفْضِيلًا) – **onları yaratdığımız məxluqların çoxuna üstün etdik.**

يَوْمَ نَدْعُوا كُلَّ أُنَاسٍ بِإِمَامِهِمْ فَمَنْ أُوتِيَ كِتَابَهُ بِيَمِينِهِ فَأُولَٰئِكَ يَقْرَؤُنَ كِتَابَهُمْ وَلَا يُظْلَمُونَ فَتِيلًا ﴿٧١﴾

---

*(*Qeyd: Allah-Təala Adəm övladına ağıl, şüur, nitq, pislə yaxşını fərqləndirə bilmə qabiliyyəti, yazıb-oxumaq, gözəl səs, boy-buxun, gözəl əzalar, təfəkkür və tədbirlə din və dünya işlərini islah edib yer üzündə hər şeyə hakim olma xüsusiyyətini bəxş edibdir. Bütün heyvanlar yeməyi ağzıyla yeyər, lakin Adəm övladına yemək yemək və digər əməllərlə də məşğul olmaq üçün gözəl əllər bəxş edibdir. Allah-Təalanın nemətlərinə görə Onu təqdis edərik. Abbasi xəlifəsi Harun ər-Rəşid qazı Əbu Yusiflə bir məclisdə olanda əmr edib yemək gətirdilər, ondan sonra qaşıq istədi, qaşıq gətirdilər, yeməyi qaşıqla yeməyə başladı. Əbu Yusif dedi: "Sənin əcdadın Abdullah ibn Abbasdan rəvayətlə (Abbasi xəlifələri Hz. Peyğəmbərin əmisi Abbasın oğlu Abdullahın nəslindəndirlər) bu qeyd olunan ayənin təfsirində belə deyiblər: "Allah-Təalanın insana lütfü budur ki, insana əl verib, əliylə yemək yeyir, amma heyvan ağzıyla yeyir. Harun ər-Rəşid Əbu Yusifdən bu sözü eşidəndə qaşığı kənara qoyub əliylə yeməyə başladı". Müəllif deyir: "İbn Abbasdan olan bu rəvayət səhihdir. Lakin qazı Əbu Yusif onun mənasını səhv başa düşüb. İbn Abbas deyib ki, Allah-Təala insanı hörmətli edib, ona əl verib, əli ilə yeyir. İnsan qaşıqla, ya hər hansı bir vasitə ilə yeyəndə də, əliylə yemiş sayılır, insan hər zaman əli ilə yeyir, qaşıq vasitəsilə, ya da qaşıqsız, bu hədisdən məqsəd o deyil ki, yeməyi, gərək, əllə yeyəsən, əgər belə olsa, bizim bəzi yeməklərimiz var ki, onları qaşıqsız yemək mümkün deyil, məsələn, şorba və s. Hansı ki sulu yeməklər gərək qaşıqla yeyilsin. Görəsən, Hz. Peyğəmbər şorba kimi yeməkləri yeyəndə qaşıqsız əli ilə yeyirdi, əllə şorba yemək mümkündürmü? Bəlkə, deyəcəksən ki, qabı əlinə götürüb qabdan içirdi? Bu da Əbu Yusifin sözünə görə səhih deyil, onun sözünə görə gərək sadəcə əllə yeyilsin. Deməli, İbn Abbasın sözündən məqsəd o deyil ki, xörək qaşıqsız yeyilməlidir, çünki qaşıq olsa da, yenə əllə yemiş sayılır").*

(Necə ki qeyd olundu, Adəm övladı heyvanatdan üstündür, amma Allah-Təalanın elə bir məxluqu var ki, Qurani-Şərifin hökmüylə onlar insandan üstündürlər. Onlar mələklərdir (ruhani qüvvələrdir). Çünki insanın insan olması mələklərin varlığı və yardımı ilə olub, necə demək olar ki, insan mələklərdən üstündür. Amma Əşəri məzhəbi mələklərin həqiqətini dərk etməyib, insanları onlara üstün saymaqla ayənin həqiqi yozumundan uzaqlaşıb, Qurani-Şərifə zidd olan bəzi uydurma hədislərə bağlanıblar. O hədisləri burada qeyd etməyə ehtiyac görmədim).

**71) (يَوْمَ نَدْعُوا كُلَّ أُنَاسٍ بِإِمَامِهِمْ)** – (qiyamət) **gündə bütün insanları* öz imam və rəhbərlərilə çağırıb, sorğu-sual üçün hazır edərik.**(Allah-Təala dünyada hər bir dəstəni öz rəhbərlərilə birlikdə dirildəcəkdir). **(فَمَنْ أُوتِيَ كِتَابَهُ بِيَمِينِهِ) - qiyamət gündə kimin kitabı** (əməllərinin qeyd olunduğu kağızı) **onun sağ əlinə verilsə,** (məlum olar ki, o şəxs cənnət əhlidir), **(فَأُولَٰئِكَ يَقْرَؤُنَ كِتَابَهُمْ وَلَا يُظْلَمُونَ فَتِيلًا) - onlar kağızlarını oxuyub şad olarlar, xurma çərdəyində olan tel qədər onlara zülm olunmaz.** (Dünyada hər bir şey yazı ilə sabit ol-

وَمَنْ كَانَ فِي هٰذِهٖٓ اَعْمٰى فَهُوَ فِي الْاٰخِرَةِ اَعْمٰى وَاَضَلُّ سَبِيلًا ﴿٧٢﴾ وَاِنْ كَادُوا لَيَفْتِنُونَكَ عَنِ الَّذٖٓي اَوْحَيْنَٓا اِلَيْكَ لِتَفْتَرِيَ عَلَيْنَا غَيْرَهُۗ وَاِذًا لَاتَّخَذُوكَ خَلٖيلًا ﴿٧٣﴾

---

duğuna görə, Allah-Təala axirətdə insanların əməllərinin kağızda qeyd olunacağını onlara misal verir, yoxsa axirətdə nə kağız, nə də yazı yoxdur)**.**

*(*Qeyd: İslam ümməti Qurani-Şərifi və Hz. Peyğəmbərin yolunu tərk edib, hər bir dəstə özünə bir rəhbər seçib, onların rəyinə tabe olub, Qurani-Şərifin ehkamı pərdə arxasında gizlin qalıbdır. Bizim bu zamanda zahirdə islam, batində bütpərəst olanlar o daş-kəsəkləri və məzarları özləri üçün ziyarətgah və yardım qapısı ediblər, hamısı qiyamət günündə qabaqlarında o rəhbərləri ilə birlikdə məhşərə gedəcəklər. Bu dövrdə ölən müsəlmanların Quranla birlikdə məhşərə gedəcəklərinə güman yoxdur).*

**72)** (وَمَنْ كَانَ فِي هٰذِهٖٓ اَعْمٰى فَهُوَ فِي الْاٰخِرَةِ اَعْمٰى وَاَضَلُّ سَبِيلًا) – (dünyada haqqı dərk etməkdən qəlb gözü) **kor olub** (haqqı dərk etməyən) **kəs, axirətdə də kor olar və** (azıb) **hidayət yolunu tapmaz.**

**73)** (وَاِنْ كَادُوا لَيَفْتِنُونَكَ عَنِ الَّذٖٓي اَوْحَيْنَٓا اِلَيْكَ لِتَفْتَرِيَ عَلَيْنَا غَيْرَهُ) **-** (Saqif tayfasından bir qrup Hz. Peyğəmbərin hüzuruna gəlib dedilər: "Ey peyğəmbər, bizə bu şeyləri bəxş etməyənə qədər biz sənin əmrinə və itaətinə tabe olmarıq, belə ki, onlarla digər ərəblərə qarşı fəxr edək: 1-bizdən zəkat alma 2-bizi savaşa aparma 3-namaz qılaq, amma namazda rüku və səcdə etməyək 4-özgə camaat bizdən borc alanda onlardan faiz almaq bizə halal olsun, biz özgə camaata borc verəndə bizdən faiz alınmasın, 5-bir il bizə vaxt ver əl-Lat adlı bütümüzə səcdə edib, bir ildən sonra onu tərk edək, bu şərtlə ki, onu öz əlimizlə qırmayaq 6-ərəblərə mane ol ki, bizim çölümüzə gəlib heyvanlarını otarıb ağaclarımızı qırmasınlar 7-əgər ərəblər səndən soruşsalar ki, niyə Saqif camaatıyla belə rəftar etdin, de ki, Allah-Təala mənə belə əmr edibdir. Kağız gətirdilər, katib "Bismillah"dan sonra belə yazdı: bu bir hökmdür, Məhəmməd peyğəmbər tərəfindən Saqif camaatına verilir: zəkat verməsinlər, savaşa getməsinlər, (burada katib dayandı), dedilər: yaz: namazda rüku və səcdə etməsinlər, (katib dayanıb Hz. Peyğəmbərə baxdı, Hz. Peyğəmbər çaşqın qaldı, razı olsun, yoxsa yox. Saqif camaatının itaət etməsini çox istəyirdi. Bu zaman Ömər ibn Xəttab ayağa durub qılıncı çəkib dedi: ey Saqif camaatı, peyğəmbərimizin qəlbini yandırdınız, Allah-Təala sizin qəlbinizi yandırsın. Dedilər: "Ey Ömər, bizim səninlə bir işimiz yoxdur, biz Məhəmmədlə danışırıq", o vaxt da bu ayə nazil oldu, ayənin mənası belədir: ey Məhəmməd)**, həqiqətən, az qalmışdı ki,** (Saqif camaatı (Təbərsi, Məcməul-Bəyan, VI/661) səni aldadıb) **sənə vəhy etdiyimiz** (əmr və hökmlərdən) **başqa** (hökmləri, öz istədikləri sözləri) **yalandan bizə isnad edəsən.** (وَاِذًا لَاتَّخَذُوكَ خَلٖيلًا) **- o vaxt, əlbəttə,** (Saqif camaatı) **səni özlərinə dost edib,** (sən də mənim dostluğumdan çıxardın)**.**

وَلَوْلَآ اَنْ ثَبَّتْنَاكَ لَقَدْ كِدْتَ تَرْكَنُ اِلَيْهِمْ شَيْـًٔا قَلِيلًاۗ ﴿٧٤﴾ اِذًا لَاَذَقْنَاكَ ضِعْفَ الْحَيٰوةِ وَضِعْفَ
الْمَمَاتِ ثُمَّ لَا تَجِدُ لَكَ عَلَيْنَا نَصِيرًا ﴿٧٥﴾ وَاِنْ كَادُوا لَيَسْتَفِزُّونَكَ مِنَ الْاَرْضِ لِيُخْرِجُوكَ مِنْهَا
وَاِذًا لَا يَلْبَثُونَ خِلَافَكَ اِلَّا قَلِيلًا ﴿٧٦﴾ سُنَّةَ مَنْ قَدْ اَرْسَلْنَا قَبْلَكَ مِنْ رُسُلِنَا وَلَا تَجِدُ لِسُنَّتِنَا تَحْوِيلًاۚ
﴿٧٧﴾ اَقِمِ الصَّلٰوةَ لِدُلُوكِ الشَّمْسِ اِلٰى غَسَقِ الَّيْلِ وَقُرْاٰنَ الْفَجْرِۜ اِنَّ قُرْاٰنَ الْفَجْرِ كَانَ مَشْهُودًا ﴿٧٨﴾

---

**74)** (وَلَوْلَآ اَنْ ثَبَّتْنَاكَ) - (ey Məhəmməd)**, əgər** (səni qoruyub haqda) **sabit etməsəydik,** (لَقَدْ كِدْتَ تَرْكَنُ اِلَيْهِمْ شَيْـًٔا قَلِيلًا) **- həqiqətən, az qalmışdı ki,** (Saqif camaatının sözlərinə qulaq asıb) **onlara az da olsa meyil edəydin.**

**75)** (اِذًا لَاَذَقْنَاكَ ضِعْفَ الْحَيٰوةِ وَضِعْفَ الْمَمَاتِ) - (ey Məhəmməd, əgər onlara meyil etsəydin)**, o vaxt da həyat və ölüm** (axirət) **əzabını sənə qat-qat artıq dadızdırardıq.** (ثُمَّ لَا تَجِدُ لَكَ عَلَيْنَا نَصِيرًا) **- ondan sonra bizə qarşı sənə kömək olub** (bizim əzabımızdan səni qoruyan bir kəs də) **tapmazdın.**

**76)** (وَاِنْ كَادُوا لَيَسْتَفِزُّونَكَ مِنَ الْاَرْضِ لِيُخْرِجُوكَ مِنْهَا) - (ey Məhəmməd)**, həqiqətən, az qalıb ki,** (Məkkə əhli) **öz məkr və hiylələriylə səni** (Məkkə) **torpağından çıxartsınlar.** (وَاِذًا لَا يَلْبَثُونَ خِلَافَكَ اِلَّا قَلِيلًا) – (əgər səni Məkkədən çıxartsalar)**, ondan sonra** (Məkkədə) **ancaq az bir zaman** (salamat və xatircəm) **qala bilərlər.** (Allah-Təalanın bu vədi doğru olub, Hz. Peyğəmbər Məkkədən Mədinəyə hicrət edəndən bir qədər sonra Bədir savaşında müşriklər zəlil olub, bir qismi öldürülüb, bir qismi də əsir oldular)**.**

**77)** (سُنَّةَ مَنْ قَدْ اَرْسَلْنَا قَبْلَكَ مِنْ رُسُلِنَا) **-** (ey Məhəmməd)**, səndən qabaq göndərdiyimiz peyğəmbərlərin arasında bu yolu** (təyin etdik ki, nə qədər ki, o peyğəmbər o camaatın arasındadır, onlara əzab göndərməyib, həlak etməyək, elə ki peyğəmbər onların arasından getdi, əzab göndərib hamısını həlak etdik, habelə ey Məhəmməd, sən də nə qədər ki, bu qövmün arasındasan, onlara heç bir bəla və əzab göndərib həlak etmərik. Nə zaman səni oradan çıxartsalar, ondan sonra əzab göndərib onları həlak və zəlil edərik)**.** (وَلَا تَجِدُ لِسُنَّتِنَا تَحْوِيلًا) **-** (ey Məhəmməd, bu bizim yolumuzdur)**. Bizim yolumuzda** (adətimizdə) **bir dəyişiklik tapa bilməzsən.** (Bəli, Allah-Təalanın adəti dəyişən deyil, əgər dəyişsə, özü də cisimlər kimi dəyişmiş olar. Allah bundan ucadır)**.**

**78)** (اَقِمِ الصَّلٰوةَ لِدُلُوكِ الشَّمْسِ اِلٰى غَسَقِ الَّيْلِ) – (bu ayə 4 namazı - zöhr, ikindi (əsr), axşam (məğrib), gecə (işa) namazlarını ehtiva edir. Buyurur: ey Məhəmməd)**, günəşin batmağa meyil etməsindən** (günortadan) **gecənin qaranlığına kimi namaz qıl,** (bu zaman içində 4 dəfə namaz qılın, peyğəmbər necə qılırsa, siz də elə qılın)**.** (وَقُرْاٰنَ الْفَجْرِ) **- bir də sübh namazını qılın,** (bu namaz digərlərindən üstün olduğuna görə, ayrı zikr olundu)**.** (اِنَّ قُرْاٰنَ الْفَجْرِ كَانَ مَشْهُودًا) **- həqiqətən, sübh namazı** (elə bir namazdır ki, gərək) **camaatla** (qı-

وَمِنَ الَّيْلِ فَتَهَجَّدْ بِهٖ نَافِلَةً لَكَۗ عَسٰٓى اَنْ يَبْعَثَكَ رَبُّكَ مَقَامًا مَحْمُودًا ﴿٧٩﴾ وَقُلْ رَبِّ اَدْخِلْن۪ي
مُدْخَلَ صِدْقٍ وَاَخْرِجْن۪ي مُخْرَجَ صِدْقٍ وَاجْعَلْ ل۪ي مِنْ لَدُنْكَ سُلْطَانًا نَص۪يرًا ﴿٨٠﴾

---

lınsın. Bu ayədən sübh namazının açıq-aşkar şəkildə, o biri namazların da işarə ilə vacib olduğu məlum olur. İmanlı şəxs gərək ayənin hökmünə itaət edib namazları vaxtında qılıb tərk etməsin)**.**

**79)** (وَمِنَ الَّيْلِ فَتَهَجَّدْ بِهٖ نَافِلَةً لَكَ) - (ey Məhəmməd)**, gecənin bir parasında** (yuxudan qalxıb) **durub gecə** (təhəccüd) **namazını qıl. Bu namaz** (5 vaxt namazdan əlavə) **ancaq sənə vacibdir.** (Ümmətinə vacib deyildir, müstəhabdır (savabdır). Elə şeylər var ki, ancaq peyğəmbərə məxsusdur. Onlardan biri də təhəccüd namazıdır)**.** (عَسٰٓى اَنْ يَبْعَثَكَ رَبُّكَ مَقَامًا مَحْمُودًا) - (ey Məhəmməd)**, ümidvar ol ki, rəbbin Allah-Təala** (qiyamət günündə) **səni** (qəbirdən çıxarıb) **bəyənilən bir məqama qaldırsın.** (Məhşər əhli də sənə baxıb, Allah-Təalanın sənə bəxş etdiyi dərəcəni görüb sənə həmd-səna edərlər. Təfsirçilər ayənin mənasını axirətə aid ediblər, amma mən həqir müəllifə görə, mənası belədir: "ey Məhəmməd, bu Məkkə əhli sənə əziyyət verib incidirlər, ümidvar ol ki, Allah-Təala sənə buradan nicat verib böyük bir məqam və mərtəbəyə yetirəcək. O vaxt da düşmənlərin sənin cəlal və izzətinə baxıb, naçar qalıb, səni vəsf edəcəklər." Necə ki belə də oldu. Məkkənin fəthində Abbas Əbu Süfyanı dar bir yerdə saxladı ki, islamın şövkət və cəlalına, Hz. Peyğəmbərin qoşununa tamaşa etsin. Əbu Süfyan Hz. Peyğəmbərin cəlalını gördükdə, onların arasından zillətlə qaçmağı yadına düşüb dedi: Əbu Kəbşə oğlunun işi çox tərəqqi edibdir. (Əbu Kəbşə bir kişiydi, Məkkədə Qüreyşin dinini tərk edib ulduzlara sitayiş edirdi. Hz. Peyğəmbər də Qüreyşin dinini tərk etdiyindən Əbu Süfyan ona Əbu Kəbşə oğlu deyirdi. Bu mənada Hz. Peyğəmbərin haqlılığına böyük möcüzə olan işarə vardır. Bu xəbər Məkkədə verilib, bir neçə ildən sonra Hz. Peyğəmbər Mədinəyə hicrət etdi. Mədinədə Hz. Peyğəmbərin işi tərəqqi edib o xəbərin doğruluğu aydın oldu. İnsaflı şəxslər diqqət etsinlər: bu məna bundan sonra gələn ayələrə daha müvafiq deyilmi?)

**80)** (وَقُلْ رَبِّ اَدْخِلْن۪ي مُدْخَلَ صِدْقٍ وَاَخْرِجْن۪ي مُخْرَجَ صِدْقٍ) - (ey Məhəmməd)**, de ki, ey rəbbim,** (Məkkədən hicrət edərkən Mədinəyə) **məni doğruluqla daxil et** (ki, hər bir elmim səndən olsun. Vəd etdiyin kimi Məni Mədinədən Məkkənin fəthindən ötrü) **çıxartdıqda da doğruluqla çıxar** (ki, cihaddan ötrü çıxmağım ancaq səndən ötrü olsun)**.** (وَاجْعَلْ ل۪ي مِنْ لَدُنْكَ سُلْطَانًا نَص۪يرًا) **- ilahi, mənə kömək üçün özündən bir qüvvət ver** (ki, o qüvvə ilə islama müxalif olanların hamısını zəlil və məğlub edim. Allah-Təala Hz. Peyğəmbərə istədiyini verdi)**.**

وَقُلْ جَٓاءَ الْحَقُّ وَزَهَقَ الْبَاطِلُۜ اِنَّ الْبَاطِلَ كَانَ زَهُوقًا ﴿٨١﴾ وَنُنَزِّلُ مِنَ الْقُرْاٰنِ مَا هُوَ شِفَٓاءٌ وَرَحْمَةٌ
لِلْمُؤْمِنِينَۙ وَلَا يَز۪يدُ الظَّالِم۪ينَ اِلَّا خَسَارًا ﴿٨٢﴾ وَاِذَٓا اَنْعَمْنَا عَلَى الْاِنْسَانِ اَعْرَضَ وَنَاٰ بِجَانِبِه۪ۚ وَاِذَا
مَسَّهُ الشَّرُّ كَانَ يَؤُ۫سًا ﴿٨٣﴾ قُلْ كُلٌّ يَعْمَلُ عَلٰى شَاكِلَتِه۪ۜ فَرَبُّكُمْ اَعْلَمُ بِمَنْ هُوَ اَهْدٰى سَب۪يلًا۟ ﴿٨٤﴾
وَيَسْـَٔلُونَكَ عَنِ الرُّوحِۜ قُلِ الرُّوحُ مِنْ اَمْرِ رَبّ۪ي وَمَٓا اُو۫ت۪يتُمْ مِنَ الْعِلْمِ اِلَّا قَل۪يلًا ﴿٨٥﴾

---

**81)** (وَقُلْ جَٓاءَ الْحَقُّ وَزَهَقَ الْبَاطِلُ) **-** (ey Məhəmməd, Məkkəni fəth edib ora daxil olduqda, o bütlərin hamısını qırıb, dağıdıb) **de ki, haqq** (islam) **gəldi və batil** (şirk –bütpərəstlik) **məhv oldu.** (اِنَّ الْبَاطِلَ كَانَ زَهُوقًا) **- həqiqətən, batil** (qalmayıb) **məhv olandır.**

**82)** (وَنُنَزِّلُ مِنَ الْقُرْاٰنِ مَا هُوَ شِفَٓاءٌ وَرَحْمَةٌ لِلْمُؤْمِن۪ينَ) **-** (ey Məhəmməd)**, biz Qurani-Şərifdən möminlərə şəfa və rəhmət olan ayələr nazil edirik,** (dərman xəstələrə şəfa verdiyi kimi o ayələr də insanların imanını artırıb cəhalətdən xilas edər. Özlərini mömin sayanlar cəhalətdən əcəb xilas olublar)**.** (وَلَا يَز۪يدُ الظَّالِم۪ينَ اِلَّا خَسَارًا) **–** (bu Quran) **zalımların ancaq zərərini artırar.**

**83)** (وَاِذَٓا اَنْعَمْنَا عَلَى الْاِنْسَانِ اَعْرَضَ وَنَاٰ بِجَانِبِه۪) **– biz insana nemət** (sağlamlıq və bol ruzi) **verdiyimiz zaman** (o nemətlərə şükür etmək əvəzinə təkəbbürlə bizi zikr etməkdən) **üz döndərib,** (kafir olar)**.** (وَاِذَا مَسَّهُ الشَّرُّ كَانَ يَؤُ۫سًا) **– nə zaman insana bir pislik** (yoxsulluq və xəstəlik) **üz versə, o vaxt da** (Allah-Təalanın lütf və rəhmətindən) **ümidsiz olar.** (Halbuki kafirlərdən başqası Allah-Təalanın rəhmətindən ümidsiz olmaz)**.**

**84)** (قُلْ كُلٌّ يَعْمَلُ عَلٰى شَاكِلَتِه۪) **-** (ey Məhəmməd, müşriklərə) **de ki, hər kəs öz xislətinə** (dininə) **görə əməl edər,** (müşriklərdən pis əməl, möminlərdən yaxşı əməl meydana gələr, siz müşriklər öz əməllərinizə davam edin, Allah-Təala sizdən intiqam alacaqdır)**.** (فَرَبُّكُمْ اَعْلَمُ بِمَنْ هُوَ اَهْدٰى سَب۪يلًا) **– rəbbiniz kimin hidayət yolunda** (haqq din üzrə) **olduğunu da bilir.**

**85)** (وَيَسْـَٔلُونَكَ عَنِ الرُّوح) **-** (Məkkə əhli gedib yəhudilərdən bir şeylər öyrənib gəlib Hz. Peyğəmbərdən soruşardılar. Yəhudilər dedilər: "Əgər ruhun həqiqətini bəyan etsə, bilin ki, o peyğəmbər deyil, əgər bəyan etməyib qeyri-müəyyən etsə, necə ki Tövratda belədir, demək o peyğəmbərdir." Məkkə əhli gəlib peyğəmbərdən ruh haqqında soruşdular. Allah-Təala bu ayədə onlara cavab verir. (Buxari, Elm 47; Müslüm, Münafiqin, 32) Buyurur: ey Məhəmməd, müşriklər) **səndən ruhun** (həqiqətini) **soruşurlar,** (ruh insana verilən ilahi bir lütfdür, ona bəzən əql, bəzən qəlb, bəzən nəfs, bəzən də ruh deyirlər, hamısı eyni şeydir)**.** (قُلِ الرُّوحُ مِنْ اَمْرِ رَبّ۪ي) **-** (ey Məhəmməd, onların cavabında) **de ki, ruh rəbbim Allah-Təalanın əmrindən olan bir şeydir.** (Ancaq onun əmriylə yaranar. Biz onun həqiqətindən agah deyilik)**.** (وَمَٓا اُو۫ت۪يتُمْ مِنَ الْعِلْمِ اِلَّا قَل۪يلًا) **-** (ey Məhəmməd)**, sizə** (ruhun həqiqətindən) **ancaq az bir elm veril-**

وَلَئِنْ شِئْنَا لَنَذْهَبَنَّ بِالَّذِي اَوْحَيْنَا اِلَيْكَ ثُمَّ لَا تَجِدُ لَكَ بِهِ عَلَيْنَا وَكِيلًا ﴿٨٦﴾ اِلَّا رَحْمَةً مِنْ رَبِّكَ
اِنَّ فَضْلَهُ كَانَ عَلَيْكَ كَبِيرًا ﴿٨٧﴾

---

**mişdir.** (İnsanın elmi nə qədər artsa da, Allah-Təalanın elminin yanında az, bəlkə də yox səviyyəsindədir. Bu ayə nazil olandan sonra səhabələr dedilər: "Ey peyğəmbər, bu ayə təkcə bizə xitab edir, yoxsa sənə də aiddir?" Buyurdu ki, "Allah-Təalanın elmi sonsuzdur, mənə də bir az elm veribdir. Hz. peyğəmbərin doğruluğuna və fəzilətinə sübut olaraq bu söz kifayət edər. Yalançı şəbədəbazlar kimi alimlik iddiası etmir, necə ki hər şeyi bildiyini iddia etmək o şəxsin yalançılığına işarədir)**.**

**86)** (وَلَئِنْ شِئْنَا لَنَذْهَبَنَّ بِالَّذِي اَوْحَيْنَا اِلَيْكَ) **-** (ey Məhəmməd, necə ki ruh elmini sizə qadağan edib onun həqiqətini heç kimə bildirməmişik)**, habelə əgər istəsək, sənə vəhy etdiyimiz** (Quranı qəlbindən) **çıxarıb apararıq,** (ondan bir iz də qalmaz)**.** (ثُمَّ لَا تَجِدُ لَكَ بِهِ عَلَيْنَا وَكِيلًا) **- ondan sonra bizə qarşı özünə bir vəkil də tapmazsan** (ki, Quranı qəlbinə qaytarıb yenidən hafizəndə saxlayasan. Bunların hamısı Allah-Təalanın əlindədir)**.**

**87)** (اِلَّا رَحْمَةً مِنْ رَبِّكَ) **- ancaq rəbbin Allah-Təalanın mərhəməti istisnadır,** (ancaq O, Quranı sənin qəlbinə qaytara bilər, başqa heç kim buna qadir deyil)**.** (اِنَّ فَضْلَهُ كَانَ عَلَيْكَ كَبِيرًا) **-** (ey Məhəmməd)**, həqiqətən, Allah-Təalanın sənə olan lütf və rəhməti çox böyükdür.** (Bu cahil ərəblərin arasından səni seçib, elm və Quran verib hünər və kamal sahibi edibdir)**.**

*(*Qeyd:* *Elmdən üstün bir şey olsaydı, Allah-Təala onunla peyğəmbərini tərifləyib ona minnət qoyardı. Elmdən üstün bir şey olmadığına görə, Allah-Təala peyğəmbərləri və alimləri elm sahibi olduqları üçün mədh edir. Xüsusilə, uca peyğəmbərimizə Qurani-Şərifi bəxş etdiyi üçün ona böyük minnət qoyub Qurana agah olmağı onun üçün uca məqam hesab edir ki, başqa heç bir peyğəmbərə bu nəsib olmayıb. Amma İslam ümməti Qurani-Şərifin elmindən xəbərsiz qalıb, onda zikr olunan hikmət və nəsihətdən, din və dünyaya mənfəət verən elmlərdən qafil olub, cəhalət və nadanlıq vadisində zəlalətə düşüb çaşqın və sərgərdan qalıblar. İslam ümmətinin tərəqqisi Quranın ehkamına əməl etməyə bağlıdır. Nə qədər ki Qurani-Şərifin hökmlərinə əməl olunmur, islam ümməti də günbəgün tənəzzül edib fəlakətə düşəcəkdir. Bizim bu dövrdə Quranın hökmü islam ümmətinin arasından demək olar ki, birdəfəlik uzaq düşüb, Quranın adından başqa bir şey qalmayıbdır. Qurani-Şərifdə əmr edilən qanunların hamısı tərk olunub lazımsız sözlər sırasına daxil olubdur. İslam ümmətinin tərəqqisindən ötrü Allah-Təala Qurani-Şərifdə zəkat və xümsü əmr edibdir. Qazancın 10-da birini verməyə zəkat, cihadda alınan qənimətin 5-də birini verməyə xüms deyilir. Əgər desən ki, bu ikincisi bu zamanda mövcud deyildir, amma birincisi mövcuddur. Onu da elə dəyişdiriblər ki, bir vilayətdə iki, üç nəfər əkinçidən başqa zəkat verməsi vacib olan adam tapılmaz, əkinçilərin də əkini məhsul verərsə, zəkat onlara vacib olar. Amma var-dövlət sahibi olan şəxslərin zəkatın həqiqətinə agah olmayıb*

قُلْ لَئِنِ اجْتَمَعَتِ الْاِنْسُ وَالْجِنُّ عَلٰٓى اَنْ يَأْتُوا بِمِثْلِ هٰذَا الْقُرْاٰنِ لَا يَأْتُونَ بِمِثْلِهٖ وَلَوْ كَانَ بَعْضُهُمْ لِبَعْضٍ
ظَهِيرًا ﴿٨٨﴾ وَلَقَدْ صَرَّفْنَا لِلنَّاسِ فِي هٰذَا الْقُرْاٰنِ مِنْ كُلِّ مَثَلٍۘ فَاَبٰٓى اَكْثَرُ النَّاسِ اِلَّا كُفُورًا ﴿٨٩﴾
وَقَالُوا لَنْ نُؤْمِنَ لَكَ حَتّٰى تَفْجُرَ لَنَا مِنَ الْاَرْضِ يَنْبُوعًاۙ ﴿٩٠﴾ اَوْ تَكُونَ لَكَ جَنَّةٌ مِنْ نَخِيلٍ وَعِنَبٍ

---

*Qurani-Şərifin hökmünü dəyişdirmələri cəhalət deyilmi? Zəkat hər il qazanılan malın mənfəətinin onda birini Allah-Təalanın əmr etdiyi şəkildə verilməsidir. Necə ki Bəraət surəsində qeyd olunubdur. Mal nağd olsun, ya olmasın, fərqi yoxdur, gərək, onun onda biri mütləq islam ümmətinə faydalı olan işlərdə sərf olunsun. Nəinki varlı şəxslər desinlər ki, mənim zəkat verməm vacib deyil. Çünki qızıl, gümüş pullarım sandığımda bir il qalmır ki, onun zəkatını da verim. Allah-Təalanın əmr etdiyi zəkat məgər belədir? Mədinədə, ya da digər bölgələrdə o dövrdə bu qədər qızıl və gümüş pul var idi ki, bir il sandıqda qalsın, ondan sonra onun zəkatını versinlər? Əksinə, Hz. Peyğəmbərin zamanında ərəblərin öz qızıl və gümüş pulları yox idi, ancaq Şama ticarətə gedənlər Bizans dövlətinin pulundan bəzən gətirərdilər. Onların miqdarı da çox vaxt bir misqal qızıl dinar, ya da bir misqal gümüş dirhəm idi. Bəzən bir misqal qızılın kənarından bir parça kəsib onunla alış-veriş edərdilər. Onun adına "qirazə" deyərdilər. Bəlkə, o dövrdə qızıl və gümüşdən zəkat almayıblar? Əksinə, zəkat hökmü bütün müsəlmanlardan ötrü vacibdir, illik qazancın maya dəyərindən artıq qalanının onda biri hökmən gərək zəkat verilsin. Əgər belə olmasa, islam ümməti özgə millətlərin qarşısında maliyyə cəhətdən zəif olub müqavimət edə bilməz. Dinin və millətin tərəqqisi var-dövlət ilədir, özgə millətlərdə buna başqa ad verilib, islam şəriətindəki adı zəkatdır. Bu səbəbdən şəriət ehkamlarının həqiqətinə diqqətlə baxmaq lazımdır, mətləbdən kənar düşdük, bu sözləri əhəmiyyətli sayıb qeyd etdik).*

**88)** (قُلْ لَئِنِ اجْتَمَعَتِ الْاِنْسُ وَالْجِنُّ عَلٰٓى اَنْ يَأْتُوا بِمِثْلِ هٰذَا الْقُرْاٰنِ)- (ey Məhəmməd)**, de ki, əgər insanlar və cinlər bu Quranın oxşarını gətirmək üçün toplansalar da,** (لَا يَأْتُونَ بِمِثْلِهٖ) **– onun oxşarını gətirə bilməzlər.** (Çünki məxluq xaliqə qarşı dura bilməz)**.** (وَلَوْ كَانَ بَعْضُهُمْ لِبَعْضٍ ظَهِيرًا) **– hətta bir-birilərinə kömək etsələr də,** (yenə bu Quranın oxşarını gətirə bilməzlər)**.**

**89)** (وَلَقَدْ صَرَّفْنَا لِلنَّاسِ فِي هٰذَا الْقُرْاٰنِ مِنْ كُلِّ مَثَلٍ) **-** (ey Məhəmməd)**, həqiqətən, biz bu Quranda hər cür məsəllər çəkdik** (ki, bəlkə, xalq ibrət alıb imana gəlsin)**.** (فَاَبٰٓى اَكْثَرُ النَّاسِ اِلَّا كُفُورًا) **– insanların əksəriyyəti isə** (Quranın sözlərini inkar edib) **kafir olmaqdan başqa bir şey qəbul etmədilər.**

**90)** (وَقَالُوا لَنْ نُؤْمِنَ لَكَ حَتّٰى تَفْجُرَ لَنَا مِنَ الْاَرْضِ يَنْبُوعًا)**–** (Qüreyş camaatına Quranın möcüzə olması məlum olduqda, başqa dəlil və sübutlarla da Quranın haqq olduğu isbat edildikdə, hər tərəfdən çarəsi kəsilən aciz şəxs kimi təzədən başqa möcüzələr istəməyə başladılar)**. Dedilər:** (ey Məhəmməd, Məkkə) **torpağından** (suyu kəsilməyən) **bir bulaq çıxartmadıqca əsla sənə iman gətirmərik.**

**92)** (اَوْ تَكُونَ لَكَ جَنَّةٌ مِنْ نَخِيلٍ وَعِنَبٍ) **-** (Qüreyş deyir: "ey Məhəmməd, əgər bu möcüzə olmasa)**, xurmadan və üzümdən bir bağın olsun,** (yoxsa bu

فَتُفَجِّرَ الْاَنْهَارَ خِلَالَهَا تَفْج۪يرًاۙ ﴿٩١﴾ اَوْ تُسْقِطَ السَّمَٓاءَ كَمَا زَعَمْتَ عَلَيْنَا كِسَفًا اَوْ تَأْتِيَ بِاللّٰهِ
وَالْمَلٰٓئِكَةِ قَب۪يلًاۙ ﴿٩٢﴾ اَوْ يَكُونَ لَكَ بَيْتٌ مِنْ زُخْرُفٍ اَوْ تَرْقٰى فِي السَّمَٓاءِۜ وَلَنْ نُؤْمِنَ لِرُقِيِّكَ حَتّٰى
تُنَزِّلَ عَلَيْنَا كِتَابًا نَقْرَؤُهُۜ قُلْ سُبْحَانَ رَبّ۪ي هَلْ كُنْتُ اِلَّا بَشَرًا رَسُولًا۟ ﴿٩٣﴾

---

Məkkədə heç bağ yoxdur), (فَتُفَجِّرَ الْاَنْهَارَ خِلَالَهَا تَفْج۪يرًا) – (ağaclarının) **arasından da şırıl-şırıl çaylar axsın.**

**92)** (اَوْ تُسْقِطَ السَّمَٓاءَ كَمَا زَعَمْتَ عَلَيْنَا كِسَفًا) – (bu da olmasa)**, iddia etdiyin kimi göyü parça-parça edib üstümüzə sal,** (müşriklər bu sözlə Allah-Təalanın - əgər biz istəsək, səmadan parçalar salıb onları həlak edərik, ayəsinə işarə edib, peyğəmbərdən möcüzə kimi bunu istəyirlər.) (اَوْ تَأْتِيَ بِاللّٰهِ وَالْمَلٰٓئِكَةِ قَب۪يلًا) **- ya da** (sözünün doğruluğuna şəhadət etsinlər deyə) **Allah-Təalanı və mələkləri götürüb gəl,**

**93)** (اَوْ يَكُونَ لَكَ بَيْتٌ مِنْ زُخْرُفٍ) **- ya da** (gecə yatıb səhər durub görək ki,) **qızıldan bir evin var,** (اَوْ تَرْقٰى فِي السَّمَٓاءِ) **- ya da** (görək ki,) **səmaya çıxırsan.** (وَلَنْ نُؤْمِنَ لِرُقِيِّكَ حَتّٰى تُنَزِّلَ عَلَيْنَا كِتَابًا نَقْرَؤُهُ) **- əgər səmaya çıxsan da,** (oradan sənin təsdiqini) **oxuyacağımız bir kitab gətirmədikcə yenə** (səmaya) **çıxdığına inanmarıq.** (Ey Məhəmməd, bu 6 möcüzədən istədiyin birini gətir, ancaq o vaxt sənə iman gətirərik)**.** (قُلْ سُبْحَانَ رَبّ۪ي) – (onların cavabında Allah-Təala peyğəmbərinə buyurur: “ey Məhəmməd, onların cavabında) **de ki, mənim rəbbim Allah-Təala hər bir eyibdən pakdır,** (nə təəccüblü sözlər deyirsiniz, məndə bu şeyləri etmə gücü yoxdur. Mən nə vaxt sizə demişəm ki, belə şeylər edərəm?) (هَلْ كُنْتُ اِلَّا بَشَرًا رَسُولًا) – (ey Qüreyş camaatı)**, mən ancaq peyğəmbər olan bir insanam.** (Allah-Təala istəsə, öz peyğəmbərinə möcüzə* bəxş edər. Məndə bir şey yoxdur ki, sizə möcüzə gətirim. Bu Quranı Allah-Təala mənə veribdir. Mənim möcüzəm budur, əgər istəsəydi, başqa möcüzə də verərdi, indi siz bu Quranın müqabilində aciz qalıb məndən başqa möcüzələr istəyirsiniz, bu olan şey deyil)**.**

*(*Qeyd: Ey peyğəmbər, sən bu Qurani-Şərifdə Allah-Təala tərəfindən ümmətinə xəbər verirsən ki, məndən belə möcüzələr əmələ gəlməz, bəs bu nə möcüzələrdir, sənin ümmətin sənə və səndən sonra imamlara və övliyalara isnad edirlər? Hər dəfə Qüreyş camaatı səndən möcüzə istəyəndə, sən Qurani-Şərifi onların qabağına qoyub deyirdin: “Mənim möcüzəm bu Qurandır. Əgər bu Quran möcüzə deyilsə, siz də bu Quran surələri kimi bir surə gətirin. Amma ya peyğəmbər, sənin ümmətin guya sənin dərəcəni artırmaqdan ötrü belə deyirlər: “Səndən nə möcüzə istəyiblərsə, guya hamısını edibsən. Bu möcüzələr ki, Qüreyş camaatı səndən istəyirdi, sən Allah-Təala tərəfindən onların cavabında buyururdun: “Mən insanam, insanda o qüdrət yoxdur ki, belə şeylər etsin.” Sən belə deyirsən. Amma sənin nadan ümmətin sənə möcüzələr isnad edirlər. Sənsə möcüzələri inkar edib deyirdin: “Məndən möcüzə meydana gəlməz.*

وَمَا مَنَعَ النَّاسَ اَنْ يُؤْمِنُوا اِذْ جَاءَهُمُ الْهُدٰى اِلَّا اَنْ قَالُوا اَبَعَثَ اللّٰهُ بَشَرًا رَسُولًا ﴿٩٤﴾ قُلْ لَوْ كَانَ
فِي الْاَرْضِ مَلٰئِكَةٌ يَمْشُونَ مُطْمَئِنِّينَ لَنَزَّلْنَا عَلَيْهِمْ مِنَ السَّمَاءِ مَلَكًا رَسُولًا ﴿٩٥﴾ قُلْ كَفٰى بِاللّٰهِ
شَهِيدًا بَيْنِي وَبَيْنَكُمْ اِنَّهُ كَانَ بِعِبَادِهٖ خَبِيرًا بَصِيرًا ﴿٩٦﴾ وَمَنْ يَهْدِ اللّٰهُ فَهُوَ الْمُهْتَدِ

---

*Amma ümmətin sənin səmada olan kürələrə də hakim olduğunu iddia edib, guya sənin şəhadət barmağınla nəhəng aya işarə edib onu iki parça şəklində yerə endirdiyini, bir parçasını sağ, digər parçasını sol qoltuğuna qoyduğunu, sonra yenidən birləşib bədirlənmiş halda səmaya qalxdığını iddia edirlər. Ey peyğəmbər, qəbirdən baş qaldırıb bu ümmətinin cəhalətinə tamaşa et, gör nə cəhalətə düşüblər. Yer kürəsindən bir qədər kiçik olan ayı sənin qoltuq altında yerləşdirməklə guya sənin şan və cəlalını artırmaq istəyirlər, halbuki bundan qafildirlər ki, bununla sənin cəlalın artmaz. Musa və İsanın göstərdiyi möcüzələri də sənə isnad edib deyirlər ki, guya hamısı səndən zahir olubdur. Amma sənin mübarək dilinlə söylədiyin Qurani-Kərimin ayələri onları təkzib edir. Ey peyğəmbər, nəinki sənə, hətta səndən başqa imam və övliyalara da bunun kimi möcüzələr isnad edib, yazdıqları kitablarda xeyli möcüzələr qeyd ediblər. Ey peyğəmbər, ümmətin yaman günə düşübdür. Əsl məqsədlərini yaddan çıxarıb, mənasız və əslsiz sözlərə yapışıbdır. İlahi, sən özün kömək ol!)*

**94)** (وَمَا مَنَعَ النَّاسَ اَنْ يُؤْمِنُوا اِذْ جَاءَهُمُ الْهُدٰى اِلَّا اَنْ قَالُوا اَبَعَثَ اللّٰهُ بَشَرًا رَسُولًا) – **insanlara** (bizim tərəfimizdən) **hidayət edən** (Quran, vəhy) **göndərdikdə, onların** (Qurana və Hz. Məhəmmədə) **iman etməsinə mane olan şey - Allah-Təala bir insanı peyğəmbər göndərdi?** (Peyğəmbər gərək mələk olsun) **- deməleridir.**

**95)** (قُلْ لَوْ كَانَ فِي الْاَرْضِ مَلٰئِكَةٌ يَمْشُونَ مُطْمَئِنِّينَ) – (ey Məhəmməd, müşriklərə de ki,) **əgər yer üzündə arxayın gəzib dolaşan mələklər** (peyğəmbər olsaydı, sizinlə ünsiyyət qurmaqdan ötrü, gərək, sizin kimi insan surətində olaydılar), (لَنَزَّلْنَا عَلَيْهِمْ مِنَ السَّمَاءِ مَلَكًا رَسُولًا) – (mələklər sizin surətdə və xasiyyətdə olsalardı)**, əlbəttə, onlara da səmadan bir mələk peyğəmbər göndərərdik.** (Belə ki, din ehkamını onlara bildirib, onlar da sizə çatdısınlar. Yəni əgər yer üzündə mələkdən peyğəmbər göndərsək, gərək, sizin kimi insan surətində olsunlar ki, sizinlə bir yerdə olub din ehkamını sizə öyrətsinlər, belə olan halda peyğəmbərin mələk, ya da insan olmasının bir fərqi yoxdur)**.**

**96)** (قُلْ كَفٰى بِاللّٰهِ شَهِيدًا بَيْنِي وَبَيْنَكُمْ) **-** (ey Məhəmməd, müşriklərə) **de ki,** (mənim sizə vəhyi təbliğ edib, Allah-Təaladan gələn hökmləri sizə bildirdiyim haqqında) **mənimlə sizin aranızda şahid olaraq Allah-Təala kifayət edər.** (Amma siz təkzib edib inadla inkar etdiniz)**.** (اِنَّهُ كَانَ بِعِبَادِهٖ خَبِيرًا بَصِيرًا) **- həqiqətən, Allah-Təala bəndələrinin əhvalını görüb xəbərdar olandır.** (Hər şəxsə öz əməlinin qarşılığını verəcəkdir)**.**

**97)** (وَمَنْ يَهْدِ اللّٰهُ فَهُوَ الْمُهْتَدِ) **- Allah-Təala kimə** (imanı istəyənə) **hidayət edib** (islamda sabit etsə)**, həqiqətən, doğru və hidayət tapan şəxs odur.**

وَمَنْ يُضْلِلْ فَلَنْ تَجِدَ لَهُمْ اَوْلِيَآءَ مِنْ دُونِهِۜ وَنَحْشُرُهُمْ يَوْمَ الْقِيٰمَةِ عَلٰى وُجُوهِهِمْ عُمْيًا وَبُكْمًا وَصُمًّاۜ مَأْوٰيهُمْ جَهَنَّمُۜ كُلَّمَا خَبَتْ زِدْنَاهُمْ سَعِيرًا ﴿٩٧﴾ ذٰلِكَ جَزَآؤُهُمْ بِاَنَّهُمْ كَفَرُوا بِاٰيَاتِنَا وَقَالُوٓا ءَاِذَا كُنَّا عِظَامًا وَرُفَاتًا ءَاِنَّا لَمَبْعُوثُونَ خَلْقًا جَدِيدًا ﴿٩٨﴾ اَوَلَمْ يَرَوْا اَنَّ اللّٰهَ الَّذِي خَلَقَ السَّمٰوَاتِ وَالْاَرْضَ قَادِرٌ عَلٰٓى اَنْ يَخْلُقَ مِثْلَهُمْ وَجَعَلَ لَهُمْ اَجَلًا لَا رَيْبَ فِيهِۜ فَاَبَى الظَّالِمُونَ اِلَّا كُفُورًا ﴿٩٩﴾ قُلْ لَوْ اَنْتُمْ تَمْلِكُونَ خَزَآئِنَ رَحْمَةِ رَبّٖٓي اِذًا لَاَمْسَكْتُمْ خَشْيَةَ الْاِنْفَاقِۜ

---

(وَمَنْ يُضْلِلْ فَلَنْ تَجِدَ لَهُمْ اَوْلِيَآءَ مِنْ دُونِهِ) - (ey Məhəmməd, Allah-Təala) **kimi** (küfrü istəyəni) **zəlalətdə qoysa, əlbəttə, onlardan ötrü** (Allah-Təaladan) **başqa dostlar** (və köməkçilər) **tapa bilməzsən** (ki, onlara əzabdan nicat versinlər). (وَنَحْشُرُهُمْ يَوْمَ الْقِيٰمَةِ عَلٰى وُجُوهِهِمْ عُمْيًا وَبُكْمًا وَصُمًّا) – (o zəlalətdə qalanları) **qiyamət günündə üzü üstə dirildərik.** (Ayağa durmağa qüdrətləri olmaz, necə ki dünyada haqqı görməkdən, haqqı danışmaqdan və haqqı eşitməkdən gözləri kor, dilləri lal, qulaqları kardır), **qiyamət günü də biz onları kor, lal və kar olaraq dirildərik.** (مَأْوٰيهُمْ جَهَنَّمُ كُلَّمَا خَبَتْ زِدْنَاهُمْ سَعِيرًا) - **onların məskəni cəhənnəmdir.** (Hər dəfə cəhənnəm odu onların bədənlərini yandırıb bitirdikcə), **atəş zəiflədikcə,** (bədənlərini geri qaytarıb) **cəhənnəm odunu artırarıq** (ki, həmişə əzabda olsunlar).

**98)** (ذٰلِكَ جَزَآؤُهُمْ بِاَنَّهُمْ كَفَرُوا بِاٰيَاتِنَا) – **bizim ayə və möcüzələrimizi inkar etdikləri üçün bu** (cəhənnəm əzabı) **onların cəzasıdır.** (وَقَالُوا ءَاِذَا كُنَّا عِظَامًا وَرُفَاتًا) (ءَاِنَّا لَمَبْعُوثُونَ خَلْقًا جَدِيدًا) - **dedilər: "Bəs biz** (öləndən sonra ətimiz tökülüb) **sür-sümük və ovxalanmış** (torpaq) **olandan sonra dirildilib yenidən məxluq olacağıq?"** (Heç vaxt belə şey olmaz. Allah-Təala növbəti ayədə onların cavabını verir).

**99)** (اَوَلَمْ يَرَوْا اَنَّ اللّٰهَ الَّذِي خَلَقَ السَّمٰوَاتِ وَالْاَرْضَ قَادِرٌ عَلٰٓى اَنْ يَخْلُقَ مِثْلَهُمْ) – (bəs qiyamət gününü inkar edənlər) **baxıb görmürlər ki,** (bu böyüklükdə) **səmaları və yeri yaradan Allah-Təala onlar kimi** (hətta sizin kimi zəif məxluqatı da) **yaratmağa qadirdir?** (وَجَعَلَ لَهُمْ اَجَلًا لَا رَيْبَ فِيهِ) – (insanı yaradandan sonra) **onlar üçün müəyyən bir vaxt** (əcəl) **təyin etdi. Onda heç bir şəkk və şübhə yoxdur.** (Öləndən sonra Allah-Təala onları diriltməyə qadirdir. Necə ki daha əvvəl yaratmışdı). (فَاَبَى الظَّالِمُونَ اِلَّا كُفُورًا) – **zalımlar isə küfrdən başqa bir şeyi qəbul etməyib razı olmurlar.**

**100)** (قُلْ لَوْ اَنْتُمْ تَمْلِكُونَ خَزَآئِنَ رَحْمَةِ رَبّٖي) - (ey Məhəmməd), **de ki,** (ey Qüreyş camaatı, məndən bağ-bağat, çaylar istəyirsiniz, halbuki Allah-Təalanın sizə verdiyi nemətlərə şükür etməyib, yenə başqa şeylər istəyirsiniz), **amma siz özünüz əgər rəbbim Allah-Təalanın rəhmət xəzinələrinə malik olsanız,** (اِذًا لَاَمْسَكْتُمْ خَشْيَةَ الْاِنْفَاقِ) – **o vaxt da onun xərclənib qurtarmasından,** (ac qalmaqdan) **qorxub xəsislik edib** (heç kimə bir şey verməzdiniz. Amma Allah-

وَكَانَ الْاِنْسَانُ قَتُورًا ﴿١٠٠﴾ وَلَقَدْ اٰتَيْنَا مُوسٰى تِسْعَ اٰيَاتٍ بَيِّنَاتٍ فَسْئَلْ بَنٖي اِسْرَٓاۤئٖيلَ اِذْ جَٓاءَهُمْ
فَقَالَ لَهُ فِرْعَوْنُ اِنّٖي لَاَظُنُّكَ يَا مُوسٰى مَسْحُورًا ﴿١٠١﴾ قَالَ لَقَدْ عَلِمْتَ مَٓا اَنْزَلَ هٰٓؤُ۬لَٓاءِ اِلَّا رَبُّ
السَّمٰوَاتِ وَالْاَرْضِ بَصَٓائِرَۚ وَاِنّٖي لَاَظُنُّكَ يَا فِرْعَوْنُ مَثْبُورًا ﴿١٠٢﴾ فَاَرَادَ اَنْ يَسْتَفِزَّهُمْ مِنَ الْاَرْضِ
فَاَغْرَقْنَاهُ وَمَنْ مَعَهُ جَمٖيعًاۙ ﴿١٠٣﴾ وَقُلْنَا مِنْ بَعْدِهٖ لِبَنٖي اِسْرَٓاۤئٖيلَ اسْكُنُوا الْاَرْضَ فَاِذَا جَٓاءَ وَعْدُ
الْاٰخِرَةِ جِئْنَا بِكُمْ لَفٖيفًاۜ ﴿١٠٤﴾ وَبِالْحَقِّ اَنْزَلْنَاهُ وَبِالْحَقِّ نَزَلَۜ

---

Təala sizin bu küfr və inadınıza baxmayaraq sizə ruzi verir. Sizsə, şükür etmək əvəzinə nankorluq edirsiniz). (وَكَانَ الْاِنْسَانُ قَتُورًا) **- insan, həqiqətən, xəsisdir.**

**101)** (وَلَقَدْ اٰتَيْنَا مُوسٰى تِسْعَ اٰيَاتٍ بَيِّنَاتٍ) **-** (ey Məhəmməd, bu müşriklər səndən möcüzə istəyib deyirlər: “Əgər möcüzə gətirsən, iman edərik”)**. Həqiqətən, Musaya açıq-aşkar 9 möcüzə verdik,** (lakin yenə Musaya iman gətirmədilər. Bu möcüzələrin təfsilatı Əraf surəsinin 135-ci ayəsində qeyd olundu)**.** (فَسْئَلْ بَنٖي اِسْرَٓاۤئٖيلَ اِذْ جَٓاءَهُمْ) – (Musa) **bəni-İsrailə** (peyğəmbər olaraq) **gəldikdə,** (Musaya dedik: “Get, firondan) **bəni-İsraili istə”,** (de ki, bəni-İsraili mənə həvalə et, onları götürüm Misirdən gedim. Musa gedib bu sözü firona dedi, firon ona belə cavab verdi:) (فَقَالَ لَهُ فِرْعَوْنُ اِنّٖي لَاَظُنُّكَ يَا مُوسٰى مَسْحُورًا) – **dedi: “Ey Musa, həqiqətən, mənim zənnim budur ki, səni sehirləyiblər,** (başın xarab olduğundan peyğəmbərlik iddiası edirsən)**.**

**102)** (قَالَ لَقَدْ عَلِمْتَ مَٓا اَنْزَلَ هٰٓؤُ۬لَٓاءِ اِلَّا رَبُّ السَّمٰوَاتِ وَالْاَرْضِ بَصَٓائِرَ) – (Musa) **dedi:** (ey firon)**, sən yaxşı bilirsən ki, bu** (9 möcüzəni) **ancaq səmaların və yerin tərbiyə verən rəbbi olan Allah göndəribdir ki,** (sizin üçün dəlil olub haqqı) **dərk edəsiniz.** (وَاِنّٖي لَاَظُنُّكَ يَا فِرْعَوْنُ مَثْبُورًا) **- ey firon, həqiqətən, mən sənin artıq həlak olduğunu zənn edirəm.** (Çünki sən mənim haqlı olduğumu bildiyin halda inkar edirsən)**.**

**103)** (فَاَرَادَ اَنْ يَسْتَفِزَّهُمْ مِنَ الْاَرْضِ) – (firon Musanı və bəni-İsraili tamamən qətlə yetirib Misir) **torpağından yox etmək** (izlərini silmək) **istədi.** (فَاَغْرَقْنَاهُ وَمَنْ مَعَهُ جَمٖيعًا) – (onun əksinə olaraq) **onun özünü və onunla birlikdə olanların hamısını** (Qırmızı dənizdə) **qərq etdik.**

**104)** (وَقُلْنَا مِنْ بَعْدِهٖ لِبَنٖي اِسْرَٓاۤئٖيلَ اسْكُنُوا الْاَرْضَ) – (fironu qərq edəndən sonra Musa vasitəsilə) **bəni-İsrailə dedik ki,** (firondan nicat tapdınız. İndi asudə olaraq) **yer üzündə sakin olun.** (فَاِذَا جَٓاءَ وَعْدُ الْاٰخِرَةِ جِئْنَا بِكُمْ لَفٖيفًا) **- axirət vədi** (qiyamət) **gəldikdə, siz** (bəni-İsraili və fironu və ona tabe olanları bir-birinizə qarışmış halda) **birlikdə** (məhşərə) **gətirərik.** (Ondan sonra aranızda hökm edib hər kəsə öz əməlinin əvəzini verərik)**.**

**105)** (وَبِالْحَقِّ اَنْزَلْنَاهُ وَبِالْحَقِّ نَزَلَ) **-** (ey Məhəmməd, biz bu Quranı hikmətlə, ədalət və) **haqla nazil etmişik. O da haqq** (və hikmətlə sənə) **nazil olubdur.**

وَمَٓا اَرْسَلْنَاكَ اِلَّا مُبَشِّرًا وَنَذ۪يرًاۢ ﴿١٠٥﴾ وَقُرْاٰنًا فَرَقْنَاهُ لِتَقْرَاَهُ عَلَى النَّاسِ عَلٰى مُكْثٍ وَنَزَّلْنَاهُ تَنْز۪يلًا
﴿١٠٦﴾ قُلْ اٰمِنُوا بِه۪ٓ اَوْ لَا تُؤْمِنُواۜ اِنَّ الَّذ۪ينَ اُو۫تُوا الْعِلْمَ مِنْ قَبْلِه۪ٓ اِذَا يُتْلٰى عَلَيْهِمْ يَخِرُّونَ لِلْاَذْقَانِ
سُجَّدًاۙ ﴿١٠٧﴾ وَيَقُولُونَ سُبْحَانَ رَبِّنَٓا اِنْ كَانَ وَعْدُ رَبِّنَا لَمَفْعُولًا ﴿١٠٨﴾ وَيَخِرُّونَ لِلْاَذْقَانِ يَبْكُونَ
وَيَز۪يدُهُمْ خُشُوعًا ﴿١٠٩﴾ قُلِ ادْعُوا اللّٰهَ اَوِ ادْعُوا الرَّحْمٰنَۜ اَيًّا مَا تَدْعُوا فَلَهُ الْاَسْمَٓاءُ الْحُسْنٰىۚ

---

(وَمَٓا اَرْسَلْنَاكَ اِلَّا مُبَشِّرًا وَنَذ۪يرًا) - (ey Məhəmməd)**, səni də ancaq** (möminlərə) **müjdə verib** (kafir və münafiqləri əzabla) **qorxudan olaraq göndərdik.** (Sənə başqa şey lazım deyil)**.**

**106)** (وَقُرْاٰنًا فَرَقْنَاهُ) **-** (ey Məhəmməd)**, bu Quranı hissə-hissə** (23 il içində sənə) **nazil etmişik** (hər bir vaxtın öz şərtinə görə hökm nazil edərik)**.** (لِتَقْرَاَهُ عَلَى النَّاسِ عَلٰى مُكْثٍ) **- ki,** (Quranı) **aramla insanlara oxuyub** (hökmlərini bəyan edəsən. Əgər Quranı birdən göndərsəydik, onda bu fayda olmazdı)**.** (وَنَزَّلْنَاهُ تَنْز۪يلًا) **– biz onu tədricən nazil etdik** (ki, hər hadisənin öz hökmü məlum olsun)**.**

**107)** (قُلْ اٰمِنُوا بِه۪ٓ اَوْ لَا تُؤْمِنُوا) **-** (ey Məhəmməd, müşriklərə) **de ki,** (Qurana) **iman gətirin, ya da gətirməyin,** (mənə bir xeyri, zərəri yoxdur, xeyri və zərəri özünüzə aiddir)**.** (اِنَّ الَّذ۪ينَ اُو۫تُوا الْعِلْمَ مِنْ قَبْلِه۪ٓ) **- həqiqətən,** (bu Qurandan əvvəl) **özlərinə elm** (Tövrat) **verilənlərə,** (Mədinədə peyğəmbərə iman gətirən yəhudilərə), (اِذَا يُتْلٰى عَلَيْهِمْ يَخِرُّونَ لِلْاَذْقَانِ سُجَّدًا)– (yəhudilərdən müsəlman olanlara Quran) **oxunduqda,** (Quranın təsirindən) **çənələri üstə səcdə edərlər.** (İnsan üzüüstə düşəndə üzündən əvvəl çənəsi yerə dəydiyindən ayədə çənə qeyd olunub)**.**

**108)** (وَيَقُولُونَ سُبْحَانَ رَبِّنَٓا) – (səcdə edib) **deyərlər: "Rəbbimiz Allah-Təala hər bir eyibdən pak və müqəddəsdir.** (اِنْ كَانَ وَعْدُ رَبِّنَا لَمَفْعُولًا) **- həqiqətən, bizim rəbbimiz Allah-Təalanın** (qiyamət və axirət haqqındakı) **vədi, əlbəttə,** (doğru olub) **vaqe olacaqdır."**

**109)** (وَيَخِرُّونَ لِلْاَذْقَانِ يَبْكُونَ) – (Quran oxunanda) **çənələri üstə düşüb** (Allah-Təalanın qorxusundan) **ağlayarlar.** (وَيَز۪يدُهُمْ خُشُوعًا) – (Quran qəlblərindəki Allah-Təala) **qorxusunu daha artırar.**

**110)** (قُلِ ادْعُوا اللّٰهَ اَوِ ادْعُوا الرَّحْمٰنَ) – (Hz. Peyğəmbər səcdə halında Allah-Təalaya müxtəlif adlarla - Allah, Rəhman, Rəhim, Rəzzaq, Xaliq və s.adlarla dua edərdi, müşriklər Hz. Peyğəmbərə tənə edib dedilər: "Məhəmməd bizə birdən çox tanrıya sitayiş etməyi qadağan edir, amma özü görün neçə Allaha dua edir?" O vaxt da bu ayə nazil oldu, ayənin mənası belədir: "ey Məhəmməd, müşriklərə) **de ki, Allah adı ilə çağırıb** (dua edin)**, ya da Rəhman adı ilə, heç bir fərqi yoxdur,** (hamısı eyni müqəddəs zatın adlarıdır)**.** (اَيًّا مَا تَدْعُوا فَلَهُ الْاَسْمَٓاءُ الْحُسْنٰى)

وَلَا تَجْهَرْ بِصَلَاتِكَ وَلَا تُخَافِتْ بِهَا وَابْتَغِ بَيْنَ ذٰلِكَ سَبِيلًا ﴿١١٠﴾ وَقُلِ الْحَمْدُ لِلّٰهِ الَّذِي لَمْ يَتَّخِذْ
وَلَدًا وَلَمْ يَكُنْ لَهُ شَرِيكٌ فِي الْمُلْكِ وَلَمْ يَكُنْ لَهُ وَلِيٌّ مِنَ الذُّلِّ وَكَبِّرْهُ تَكْبِيرًا ﴿١١١﴾

---

**– necə çağırırsınız çağırın, gözəl adlar Ona aiddir,** (fərqi yoxdur, məqsəd bir olan müqəddəs zata ibadət etməkdir)**.** (وَلَا تَجْهَرْ بِصَلَاتِكَ وَلَا تُخَافِتْ بِهَا) - (Hz. Peyğəmbər Məkkədə Məscidül-haramda namaz qılanda səsini ucaldıb namaz qılardı, Allah-Təala bu ayədə Hz. Peyğəmbərə ucadan və ya gizlin namaz qılmağı qadağan edib buyurur: ey Məhəmməd, namaz qılanda) **səsini ucaltma** (Buxari, Tövhid, 34-44; Müslüm, Salat, 145) (ki, kənarda olan müşriklər eşidib gəlib sənə əziyyət etməsinlər, bir də yüksək səslə namaz qılmaq ədəbsizlikdir)**. Səsini alçaltma da** (ki, arxanda duranlar səsini eşidə bilsinlər)**.** (وَابْتَغِ بَيْنَ ذٰلِكَ سَبِيلًا) **– bu ikisi arasında** (orta) **bir yol seç,** (namazı nə çox ucadan, nə də çox alçaqdan qıl)***.**

*(*__Qeyd:__ Bu hökm - 5 vaxt namazdan ötrüdür. 5 vaxt namazın hamısı gərək bu şəkildə qılınsın. Ayənin hökmü belədir. Amma islam ümmətindən heç bir qrup Quranın bu açıq-aşkar hökmünə əməl etmir, hamısı Quranı tərk edib bəzi uydurma hədislərə yapışıblar, hər bir dəstə özünə bir yol seçibdir. Bir dəstə gündüz namazını (zöhr, ikindi) səssiz, gecə namazını (məğrib, işa) və sübh namazını (onu da gecə namazı kimi sayıb) yüksək səslə qılırlar, amma başqa bir dəstə sübh namazını yüksək səslə, zöhr, ikindi namazlarını səssiz, axşamın ilk iki rükətini ucadan, axır iki rükətini səssiz, işanın ilk iki rükətini yüksək səslə, son iki rükətini səssiz qılırlar. İnsafla baxaq görək, bunların hansı Qurana uyğundur? Hamısı uydurma hədislərə uyğun olub Qurana zidd şeylərdir. Quranı qoyub, Abdullah ibn Ömərin, ibn Asın, Əbül-Büxtərinin, Vəhb ibn Münəbbihin, Kə`b əl-Əxbarın və Əmmar Sabatinin hədislərinə yapışmaq insafdan və elmdən son dərəcə uzaqdır. Bundan əlavə axırıncı iddiaya uyğun heç zəif hədis də yoxdur. Mən həqir müəllif heç bilmirəm, bu təfsilatları haradan çıxarırlar. Biz hər bir halda, gərək, Allah-Təalanın kitabına etimad edək, o hökm ki, Qurani-Şərifdə olmadı, gərək, Hz. Peyğəmbərin sünnəsində olan hökmləri qəbul edib, ona əməl edək).*

**111)** (وَقُلِ الْحَمْدُ لِلّٰهِ الَّذِي لَمْ يَتَّخِذْ وَلَدًا وَلَمْ يَكُنْ لَهُ شَرِيكٌ فِي الْمُلْكِ) – (surənin axırında Allah-Təala öz peyğəmbərinə Ona həmd-səna etməyi əmr edir: "ey Məhəmməd)**, de ki, həmd-səna özünə heç bir övlad götürməyən və mülkündə** (səltənətində) **heç bir şəriki olmayan Allah-Təalaya layiqdır.** (وَلَمْ يَكُنْ لَهُ وَلِيٌّ مِنَ الذُّلِّ) **- Allah-Təala zəif olmadığına görə, köməkçiyə də ehtiyacı yoxdur.** (وَكَبِّرْهُ تَكْبِيرًا) **- Allah-Təalanı son dərəcə böyük bil,** (övlad və şərik qoşmağı ona layiq görmə)**."**

Allaha həmd olsun. İsra surəsinin təfsiri bitdi. Əbdülmüttəlib nəslindən nə zaman bir uşaq təzə dil açsa, Hz. Peyğəmbər bu axırıncı ayəni ona öyrətməyi əmr edərdi. Hz. Peyğəmbər buyurubdur: "Kim İsra surəsini oxuyub, ata-anası yadına düşəndə qəlbi yumşalsa, Allah-Təala cənnətdə ona çoxlu əcr verər." (Qazi Beyzavi, Ənvarut-Tənzil, IV/80)




# əl-KƏHF SURƏSİ

18-ci surədir. Məkkədə nazil olub, 110 ayə, 1577 kəlmə, 6360 hərfdir.

بِسْمِ اللّٰهِ الرَّحْمٰنِ الرَّحِيمِ. اَلْحَمْدُ لِلّٰهِ الَّذٖٓي اَنْزَلَ عَلٰى عَبْدِهِ الْكِتَابَ وَلَمْ يَجْعَلْ لَهُ عِوَجًاۜ ﴿١﴾ قَيِّمًا
لِيُنْذِرَ بَأْسًا شَدٖيدًا مِنْ لَدُنْهُ وَيُبَشِّرَ الْمُؤْمِنٖينَ الَّذٖينَ يَعْمَلُونَ الصَّالِحَاتِ اَنَّ لَهُمْ اَجْرًا حَسَنًاۙ ﴿٢﴾
مَاكِثٖينَ فٖيهِ اَبَدًاۙ ﴿٣﴾ وَيُنْذِرَ الَّذٖينَ قَالُوا اتَّخَذَ اللّٰهُ وَلَدًاۗ ﴿٤﴾ مَا لَهُمْ بِهٖ مِنْ عِلْمٍ وَلَا لِاٰبَٓائِهِمْۜ كَبُرَتْ
كَلِمَةً تَخْرُجُ مِنْ اَفْوَاهِهِمْۜ اِنْ يَقُولُونَ اِلَّا كَذِبًا ﴿٥﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1)** (اَلْحَمْدُ لِلّٰهِ الَّذٖي اَنْزَلَ عَلٰى عَبْدِهِ الْكِتَابَ) – (Allah-Təala bu ayədə bəndələrinə ona necə həmd-səna etmələri gərəkdiyini öyrədir:) **həmd-səna o Allah-Təalaya layiqdir ki, qulu** (Hz. Məhəmmədə əs., Quran) **kitabını nazil edib, xalqa halal və haramı bəyan edibdir.** (وَلَمْ يَجْعَلْ لَهُ عِوَجًا) – (Allah-Təala Quranın mənasına) **bir əyrilik** (ziddiyyət) **qoymadı.**

**2-3)** (قَيِّمًا) **- əksinə, onu möhkəm** (doğru etdi ki, heç bir eyib və nöqsanı olmasın)**.** (لِيُنْذِرَ بَأْسًا شَدٖيدًا مِنْ لَدُنْهُ) **- belə ki,** (peyğəmbərimiz onunla kafirləri) **Allah-Təala tərəfindən olan şiddətli bir əzabla qorxutsun.** (وَيُبَشِّرَ الْمُؤْمِنٖينَ الَّذٖينَ يَعْمَلُونَ الصَّالِحَاتِ) **- və saleh əməl edən möminlərə müjdə versin.** (اَنَّ لَهُمْ اَجْرًا حَسَنًا مَاكِثٖينَ فٖيهِ اَبَدًا) **- həqiqətən,** (o möminlərdən ötrü) **Allah-Təala yanında gözəl əcr və savab vardır. Orada əbədi qalacaqlar.**

**4)** (وَيُنْذِرَ الَّذٖينَ قَالُوا اتَّخَذَ اللّٰهُ وَلَدًا) – **və** (bu Quranla) **- Allah-Təala özünə övlad götürüb, deyənləri də qorxutsun.** (Müşriklər mələkləri Allah-Təalanın qızları, xristianlar İsanı, yəhudilər Üzeyri Allahın oğlu sayırdılar)**.**

**5)** (مَا لَهُمْ بِهٖ مِنْ عِلْمٍ وَلَا لِاٰبَائِهِمْ) - (Allah-Təalanın övladı olması haqqında) **nə onların, nə də ata-babalarının heç bir biliyi yoxdur.** (Zənn və güman üzrə belə deyirlər. Əgər bilikləri olsaydı, Allah-Təalaya övlad isnad etməzdilər)**.** (كَبُرَتْ كَلِمَةً تَخْرُجُ مِنْ اَفْوَاهِهِمْ) **- ağızlarından çıxan söz** (Allah-Təalaya övlad isnad etmək) **nə böyük** (təəccüblü) **sözdür,** (nə cürətlə belə söz deyirlər? Bəzən şeytan insanın qəlbinə vəsvəsə salsa da, insan onu deməyə həya edər. Amma bunlar gör nə qədər həyasızdırlar ki, belə qəbih sözü dillərinə gətirirlər)**.** (اِنْ يَقُولُونَ اِلَّا كَذِبًا) – **onlar ancaq yalan deyirlər,** (bu sözləri mütləq yalandır)**.**

فَلَعَلَّكَ بَاخِعٌ نَفْسَكَ عَلٰٓى اٰثَارِهِمْ اِنْ لَمْ يُؤْمِنُوا بِهٰذَا الْحَدِيثِ اَسَفًا ﴿٦﴾ اِنَّا جَعَلْنَا مَا عَلَى الْاَرْضِ زِينَةً لَهَا لِنَبْلُوَهُمْ اَيُّهُمْ اَحْسَنُ عَمَلًا ﴿٧﴾ وَاِنَّا لَجَاعِلُونَ مَا عَلَيْهَا صَعِيدًا جُرُزًاۜ ﴿٨﴾ اَمْ حَسِبْتَ اَنَّ اَصْحَابَ الْكَهْفِ وَالرَّقِيمِ كَانُوا مِنْ اٰيَاتِنَا عَجَبًا ﴿٩﴾

---

**6)** (فَلَعَلَّكَ بَاخِعٌ نَفْسَكَ عَلٰى اٰثَارِهِمْ اِنْ لَمْ يُؤْمِنُوا بِهٰذَا الْحَدِيثِ اَسَفًا) - (ey Məhəmməd, bu Qüreyş tayfası Qurana niyə) **iman etmir deyə sən şiddətli qəm və qüssədən özünü həlak edəcəksən?**

**7)** (اِنَّا جَعَلْنَا مَا عَلَى الْاَرْضِ زِينَةً لَهَا) - **həqiqətən, biz yer üzündə olan şeyləri** (yer əhlindən ötrü) **zinət etdik.** (لِنَبْلُوَهُمْ اَيُّهُمْ اَحْسَنُ عَمَلًا)**- belə ki,** (o zinətin səbəbinə) **imtahan edib** (onların özünə də məlum olsun ki,) **onların hansı birinin əməli daha gözəldir?** (Və hansı biri Allah-Təalaya itaət edib onun nemətlərinə şükür edir?)

**8)** (وَاِنَّا لَجَاعِلُونَ مَا عَلَيْهَا صَعِيدًا جُرُزًا) - (ey Məhəmməd, yer üzündə o zinətləri yaradandan sonra həqiqətən qiyamət günündə) **əlbəttə, onları** (zinətləri, heyvanatı, nəbatatı) **yox edib, quru torpaq edərik.**

**9)** (اَمْ حَسِبْتَ اَنَّ اَصْحَابَ الْكَهْفِ وَالرَّقِيمِ كَانُوا مِنْ اٰيَاتِنَا عَجَبًا) - (ey Məhəmməd)**, sən belə güman edirsən ki,* ayələrimizdən olan Kəhf və Rəqim əhlinin əhvalatı çox təəccüblüdür?** (Ondan daha təəccüblüsü yer üzünü zinətləndirəndən sonra qiyamət günündə onu qupquru etməkdir)**.**

*(***Qeyd:** Kəhf mağaraya deyilir. Rəqim əshabi-kəhfin itlərinin adıdır. Bundan sonra əshabi-Kəhfin əhvalatı qeyd edilir. Əshabi-kəhfin əhvalatı qısaca belədir: İsa ibn Məryəmdən bir müddət sonra Rum (İtaliya) məmləkətində xristianlıq yayılıb camaat Allah-Təalaya ibadət etməyə başladı. Bir müddət Allaha ibadət etdilər. Daha sonra aralarında fasiq və günahkar padşahlar meydana gəlib camaatı ibadəti tərk etməyə, oyun və günaha vadar etdilər. O cümlədən Daqyanus adlı bir padşah Rum məmləkətinə sahib olduqda camaatı günah və bütpərəstliyə dəvət etdi. Möminlərdən bir xeyli adam onun dəvətini qəbul etməyib dinlərində möhkəm durdular. Ondan sonra Daqyanusun qəhr və qəzəbindən qorxub, bir qədər xərclik götürüb, gizlicə şəhərdən çıxıb hicrət etdilər. Yol əsnasında qoyun otaran bir çobana rast gəldilər. O çoban da onlara qoşuldu. Çobanın iti sahibindən aralanmayıb onların dalınca getdi. Onlar çobana dedilər: "Sən bu iti qaytar. Bunun səsindən bizi taparlar." Çoban o iti döyüb qovsa da, o it qayıtmadı, axırda naçar qalıb itdən əl çəkib yola davam etdilər. Gedib o ətrafda olan bir dağa çatdılar. O dağda böyük bir mağara var idi. O mağaraya sığındılar. Allah-Təala öz kamil qüdrəti ilə onları yatırdıb, neçə illər yuxu halətində qalıb bədənlərini çürüməkdən qorudu. Daqyanus həlak olub bir xeyli padşahlar gəlib-getdilər. Rum məmləkətinə adil və saleh bir padşah sahib oldu, onun zamanında qiyamət və insanın dirilməsi haqda camaat arasında ixtilaf oldu. O padşah Allah-Təalaya ibadət edib bu ixtilafı yox edib, haqqı ona məlum etməyi xahiş etdi. Allah-Təala xalqa bir əlamət göstərmək istəyib, əshabi-kəhfi yuxudan oyatdı. Qapı ağzında yatan it də oyandı. Bir-birilərinə baxıb salam-kəlamdan sonra öz hallarının dəyişməsinə təəccüb etdilər. Libasları xarab olub,*

**اِذْ اَوَى الْفِتْيَةُ اِلَى الْكَهْفِ فَقَالُوا رَبَّنَا اٰتِنَا مِنْ لَدُنْكَ رَحْمَةً وَهَيِّئْ لَنَا مِنْ اَمْرِنَا رَشَدًا ﴿١٠﴾**

---

*surətləri dəyişmiş, tükləri və dırnaqları uzanmışdı. Dedilər: "Görəsən, biz nə qədər yatmışıq?" Biri dedi: "Bir gün", o birisi dedi: "Yarım gün", o birisi onlara baxıb dedi: "Allah-Təala bilir nə qədər yatmışıq." Ondan sonra bir nəfəri şəhərə göndərdilər ki, onlardan ötrü yemək gətirsin. Dedilər: "Bax gör, pak, pakizə yemək olsun." Çünki Daqyanus zamanında heç kim pislikdən çəkinməzdi. Onlar Daqyanusun padşah olduğunu zənn edib, ona ehtiyatlı olmağı tapşırdılar. O şəxs getdi, şəhərə çatanda hər bir şeyin dəyişdiyini görüb təəccüb etdi. Ondan sonra şəhərə daxil olub yenə dükan, bazarın, camaatın dəyişdiyini gördü. Xalqın ona baxdığını görüb qorxdu ki, birdən onu tanıyıb Daqyanusa xəbər verərlər. Tez bir dükana girib yemək almaq üçün pul verdi. Dükançı pulu götürüb diqqətlə baxmağa başladı, o şəxs də onun diqqətlə baxmasına təəccüb edirdi. Ondan sonra dükançı dedi: "Bu pul səndə haradandır?" Dedi: "Bu pul bu şəhərdə işlənilən puldur." Dükançı dedi: "Nə deyirsən? Bu Daqyanusun sikkəsidir, Daqyanusdan neçə yüz il keçibdir." Bu sözü deyəndə o mömin çaşqın qaldı. Dükançı dedi: "Əgər xəzinə tapıbsansa, gəl mənimlə şərik ol, bölək. O şəxs and içib dedi ki, xəzinə tapmayıb." Dükançı gördü, bunda bir sirr var. Hökumətə xəbər etdi. O şəxsi tutub apardılar. Onu aparanda qorxdu ki, birdən Daqyanus padşah olar, amma hökumət adamlarının əlamətlərindən onların dəyişdiyini görüb təəccüb edirdi. Onu padşahın hüzuruna apardılar. Baxdı, gördü, padşah Daqyanus deyildir. Qəlbi bir qədər aram oldu. Ondan sonra padşah ondan əhvalatı soruşdu. Onu xatircəm etdi ki, qorxma, sənə heç bir zərər dəyməz. O şəxs əhvalatı danışdı. Padşah təəccüb edib dedi: "Sənin bu şəhərdə evin var idi." Dedi: "Bəli, ailəm, uşağım var idi" Padşah özü durub onun evinə getdi. Dedi: "Mənim evim bu yerdə idi. Amma bu o ev deyil, dəyişibdir." O evdən qoca bir kişi çıxıb ondan əhvalatı soruşdular. Dedi: "Bəli, mənim Təmlixa adlı böyük babam Daqyanusun zamanında bir neçə nəfərlə filan tarixdə bu şəhərdən hicrət ediblər. Ondan sonra onlardan bir xəbər gəlməyib." O şəxsdən adını soruşdular. Dedi: "Təmlixadır." Bəli, Təmlixa yuxudan ayılmış kimi oldu. Yoldaşlarını soruşdular. Dedi: "Filan dağdakı mağarada məni gözləyirlər." Padşah əyanları ilə şəhərdən çıxıb dedi: "Gərək, onları ziyarət edək." Yol əsnasında Təmlixa dedi: "Mənə izin verin, qabaqca gedib onları əhvalatdan agah edim." İzin verdilər. Təmlixa gedib əhvalatı yoldaşlarına nəql etdi. Hamısı bildilər ki, Allah-Təala xalqa möcüzə göstərmək üçün onları seçibdir. Padşah əyanları ilə onları ziyarət edib xeyli təəccüb etdilər. Ondan sonra padşaha dedilər: "Təvəqqe edirik ki, bizdən kənar dayanasınız." Padşah və əyanları kənara çəkildilər. Onlar Allaha dua edib, əvvəlki hallarına qayıtmağı xahiş etdilər. Allah-Təala da onların canlarını aldı. Bir müddət sonra padşah onların halından xəbərdar olub hökm verib oranı məscid etdilər. Necə ki Allah-Təala bundan sonra gələn ayələrdə bunu xəbər verir).*

**10)** (اِذْ اَوَى الْفِتْيَةُ اِلَى الْكَهْفِ) – (Daqyanusdan qaçıb hicrət edən cavanlar gedib) **mağaraya sığındıqda,** (فَقَالُوا رَبَّنَا اٰتِنَا مِنْ لَدُنْكَ رَحْمَةً) – (Allah-Təalaya dua edib) **dedilər: "Ey bizim rəbbimiz, bizə öz yanından lütf və rəhmət verib,** (düşmənlərdən bizi qoru)**.** (وَهَيِّئْ لَنَا مِنْ اَمْرِنَا رَشَدًا) – (kafirlərdən qaçmamız üçün) **işimizdə bizə qurtuluş ver** (ki, hidayət tapanlardan olaq. Ondan sonra gedib mağarada birlikdə qaldılar)**.**

فَضَرَبْنَا عَلٰىٓ اٰذَانِهِمْ فِي الْكَهْفِ سِنِينَ عَدَدًاۙ ﴿١١﴾ ثُمَّ بَعَثْنَاهُمْ لِنَعْلَمَ اَيُّ الْحِزْبَيْنِ اَحْصٰى لِمَا لَبِثُوٓا اَمَدًاࣖ ﴿١٢﴾ نَحْنُ نَقُصُّ عَلَيْكَ نَبَاَهُمْ بِالْحَقِّۜ اِنَّهُمْ فِتْيَةٌ اٰمَنُوا بِرَبِّهِمْ وَزِدْنَاهُمْ هُدًىۗ ﴿١٣﴾ وَرَبَطْنَا عَلٰى قُلُوبِهِمْ اِذْ قَامُوا فَقَالُوا رَبُّنَا رَبُّ السَّمٰوَاتِ وَالْاَرْضِ لَنْ نَدْعُوَا مِنْ دُونِهٖٓ اِلٰهًا لَقَدْ قُلْنَٓا اِذًا شَطَطًا ﴿١٤﴾ هٰٓؤُ۬لَٓاءِ قَوْمُنَا اتَّخَذُوا مِنْ دُونِهٖٓ اٰلِهَةًۜ لَوْلَا يَأْتُونَ عَلَيْهِمْ بِسُلْطَانٍ بَيِّنٍۜ فَمَنْ اَظْلَمُ مِمَّنِ افْتَرٰى عَلَى اللّٰهِ كَذِبًاۜ ﴿١٥﴾

---

**11)** (فَضَرَبْنَا عَلٰٓى اٰذَانِهِمْ فِي الْكَهْفِ سِنِينَ عَدَدًا) - (ey Məhəmməd, o cavanların) **qulaqlarına mağarada bir neçə il pərdə qoyub,** (heç nə eşitməsinlər deyə onları yuxuya düçar etdik. Rahat yatmağın yolu heç nə eşitməməkdir. Ola bilər ki, gözü yatıb, qulaqları eşitsin. Qulaqlar eşitməsə, daha rahat yatar)**.**

**12)** (ثُمَّ بَعَثْنَاهُمْ لِنَعْلَمَ اَيُّ الْحِزْبَيْنِ اَحْصٰى لِمَا لَبِثُوا اَمَدًا) – (bir neçə il yatandan) **sonra onları oyatdıq ki, hansı dəstənin** (onların yatdığı) **vaxtı daha düzgün hesablaya bildiyinə agah olaq.** (Şəhər əhalisi onların yatıb qaldığı vaxt barəsində ixtilaf etdiklərindən Allah-Təala bu kəlamı buyurur. Allah-Təala bizə misal çəkmək üçün özünü bizə oxşadıb belə deyir)**.**

**13)** (نَحْنُ نَقُصُّ عَلَيْكَ نَبَاَهُمْ بِالْحَقِّ) – (ey Məhəmməd, əshabi-Kəhfin) **xəbərlərini sənə haqq** (və doğru) **olaraq danışırıq.** (اِنَّهُمْ فِتْيَةٌ اٰمَنُوا بِرَبِّهِمْ وَزِدْنَاهُمْ هُدًى) **- həqiqətən, onlar Rəblərinə iman gətirən bir neçə nəfər cavan idi. Biz də** (onlara yardım edib iman və) **hidayətlərini artırdıq.**

**14)** (وَرَبَطْنَا عَلٰى قُلُوبِهِمْ اِذْ قَامُوا) – (onlar zalım padşah Daqyanusun qabağında) **durub,** (padşah da onları bütpərəstliyə dəvət etdikdə) **onların qəlblərinə qüvvət verib möhkəmləndirdik.** (فَقَالُوا رَبُّنَا رَبُّ السَّمٰوَاتِ وَالْاَرْضِ) **- dedilər: "Bizim rəbbimiz səmaların və yerin tərbiyə verən rəbbi Allah-Təaladır.** (لَنْ نَدْعُوَا مِنْ دُونِهٖٓ اِلٰهًا) **- heç vaxt Ondan başqa bir məbuda ibadət etmərik.** (لَقَدْ قُلْنَٓا اِذًا شَطَطًا) **- əgər** (bir başqasına məbud) **desək, o vaxt** (zülm edib) **həddi aşan söz demiş olarıq.** (Necə ola bilər ki, Allah-Təalanı qoyub başqa məbudlara sitayiş edək?)

**15)** (هٰٓؤُ۬لَٓاءِ قَوْمُنَا اتَّخَذُوا مِنْ دُونِهٖٓ اٰلِهَةً) - (cavanlar deyir: bu şəhərin əhalisi) **bizim öz camaatımızdır ki, Allah-Təaladan başqa, özlərinə tanrılar qəbul edib** (Allah-Təalaya şərik qoşublar)**.** (لَوْلَا يَأْتُونَ عَلَيْهِمْ بِسُلْطَانٍ بَيِّنٍ) – (əgər bütə sitayiş etmək haqdırsa, niyə onlara ibadət etməyə görə bütpərəstlər) **açıq-aşkar bir dəlil gətirmirlər,** (ki, dəlil üzrə məlum olsun ki, bütə sitayiş etmək caizdir. Bütpərəstliyə dair dəlil gətirmək imkansız olduğundan onlardan dəlil istədilər ki, bəlkə, aciz qalıb bütpərəstliyi tərk edib yeganə olan Allah-Təalaya ibadət etsinlər)**.** (فَمَنْ اَظْلَمُ مِمَّنِ افْتَرٰى عَلَى اللّٰهِ كَذِبًا) **- Allah-Təalaya qarşı yalan uyduran-**

وَاِذِ اعْتَزَلْتُمُوهُمْ وَمَا يَعْبُدُونَ اِلَّا اللّٰهَ فَأْوُۤا اِلَى الْكَهْفِ يَنْشُرْ لَكُمْ رَبُّكُمْ مِنْ رَحْمَتِهٖ وَيُهَيِّئْ لَكُمْ مِنْ
اَمْرِكُمْ مِرْفَقًا ﴿١٦﴾ وَتَرَى الشَّمْسَ اِذَا طَلَعَتْ تَزَاوَرُ عَنْ كَهْفِهِمْ ذَاتَ الْيَمِينِ وَاِذَا غَرَبَتْ تَقْرِضُهُمْ
ذَاتَ الشِّمَالِ وَهُمْ فِي فَجْوَةٍ مِنْهُ ذٰلِكَ مِنْ اٰيَاتِ اللّٰهِ مَنْ يَهْدِ اللّٰهُ فَهُوَ الْمُهْتَدِ وَمَنْ يُضْلِلْ فَلَنْ تَجِدَ
لَهُ وَلِيًّا مُرْشِدًا ﴿١٧﴾ وَتَحْسَبُهُمْ اَيْقَاظًا وَهُمْ رُقُودٌ وَنُقَلِّبُهُمْ ذَاتَ الْيَمِينِ وَذَاتَ الشِّمَالِ وَكَلْبُهُمْ
بَاسِطٌ ذِرَاعَيْهِ بِالْوَصِيدِ لَوِ اطَّلَعْتَ عَلَيْهِمْ لَوَلَّيْتَ مِنْهُمْ فِرَارًا وَلَمُلِئْتَ مِنْهُمْ رُعْبًا ﴿١٨﴾

---

**dan** (iftira edərək Ona şərik qoşub, Allah-Təalanın da bundan razı olduğunu deyən) **şəxsdən daha zalım olan kimdir?**

**16)** (وَاِذِ اعْتَزَلْتُمُوهُمْ وَمَا يَعْبُدُونَ اِلَّا اللّٰهَ) – (cavanlar şəhərdən hicrət edib getməyə başladıqda, bir-birilərinə dedilər:) **indi ki camaatdan kənar olub Allah-Təaladan başqa ibadət etdikləri** (bütlərdən) **uzaq oldunuz,** (فَأْوُۤا اِلَى الْكَهْفِ يَنْشُرْ لَكُمْ رَبُّكُمْ مِنْ رَحْمَتِهٖ) **- gəlin mağaraya daxil olun ki, Allah-Təala rəhmətini sizin üçün yayıb** (sizə şamil etsin). (وَيُهَيِّئْ لَكُمْ مِنْ اَمْرِكُمْ مِرْفَقًا) – (Allah-Təala hicrət etdiyinizə görə) **işinizi asanlaşdırıb mənfəət versin.** (Əshabi-kəhfin sözləri burada bitdi, bundan sonra Allah-Təala peyğəmbərinə xitab edib onların qissəsini bəyan edir).

**17)** (وَتَرَى الشَّمْسَ اِذَا طَلَعَتْ تَزَاوَرُ عَنْ كَهْفِهِمْ ذَاتَ الْيَمِينِ) - (ey Məhəmməd), **əgər onların mağarasının yanında olsaydın, hər halda günəşin doğarkən onların mağaralarının sağ tərəfinə meyil etdiyini,** (وَاِذَا غَرَبَتْ تَقْرِضُهُمْ ذَاتَ الشِّمَالِ) **– günəş batdıqda isə, onları tərk edib, mağaralarının sol tərəfinə yönəlib keçdiyini görərdin.** (Günəşin doğuş və batışında günəşin hərarəti onlara təsir etməzdi). (وَهُمْ فِي فَجْوَةٍ مِنْهُ) **– onlar o geniş mağaranın ortasında olub** (Allah-Təala da onları orada günəşin hərarətindən və zərər verən hər şeydən qorudu). (ذٰلِكَ مِنْ اٰيَاتِ اللّٰهِ) - (ey Məhəmməd), **bu** (əshabi-Kəhfin əhvalatı) **Allah-Təalanın dəlil və sübutlarındandır,** (onun tövhid və qüdrətinə dəlalət edir). (مَنْ يَهْدِ اللّٰهُ فَهُوَ الْمُهْتَدِ) **- Allah-Təala kimə hidayət etsə, həqiqətən, o, hidayət tapandır.** (Necə ki əshabi-Kəhfə hidayət etdi). (وَمَنْ يُضْلِلْ) **- və Allah-Təala kimi** (öz xəbis əməlinə görə) **zəlalətdə qoysa,** (فَلَنْ تَجِدَ لَهُ وَلِيًّا مُرْشِدًا) **– heç vaxt onu** (haqqa tərəf) **irşad edən bir dost** (və köməkçi) **tapa bilməzsən.**

**18)** (وَتَحْسَبُهُمْ اَيْقَاظًا وَهُمْ رُقُودٌ) - (ey Məhəmməd, əgər sən onları yatdıqları halda görsəydin, hər halda) **onları oyaq hesab edərdin, halbuki yatmışdılar.** (O tərəf, bu tərəfə hərəkət etmələrindən elə məlum olurdu ki, sanki oyaq halda uzanıblar). (وَنُقَلِّبُهُمْ ذَاتَ الْيَمِينِ وَذَاتَ الشِّمَالِ) - (ey Məhəmməd), **biz onları sağa-sola çevirirdik** (ki, yerin rütubətindən bədənlərinə bir zərər gəlməsin). (وَكَلْبُهُمْ بَاسِطٌ ذِرَاعَيْهِ بِالْوَصِيدِ) - (ey Məhəmməd), **onların itinin də** (mağaranın) **astanasında əllərini yerə uzadıb** (yatdığını görərdin). (Necə ki yatan itin adətidir). (لَوِ اطَّلَعْتَ عَلَيْهِمْ لَوَلَّيْتَ مِنْهُمْ فِرَارًا وَلَمُلِئْتَ مِنْهُمْ رُعْبًا) - (ey Məhəmməd), **əgər onları**

وَكَذٰلِكَ بَعَثْنَاهُمْ لِيَتَسَٓاءَلُوا بَيْنَهُمْۜ قَالَ قَٓائِلٌ مِنْهُمْ كَمْ لَبِثْتُمْۜ قَالُوا لَبِثْنَا يَوْمًا اَوْ بَعْضَ يَوْمٍۜ قَالُوا رَبُّكُمْ اَعْلَمُ بِمَا لَبِثْتُمْ فَابْعَثُٓوا اَحَدَكُمْ بِوَرِقِكُمْ هٰذِهٓ اِلَى الْمَدِينَةِ فَلْيَنْظُرْ اَيُّهَٓا اَزْكٰى طَعَامًا فَلْيَأْتِكُمْ بِرِزْقٍ مِنْهُ وَلْيَتَلَطَّفْ وَلَا يُشْعِرَنَّ بِكُمْ اَحَدًا ﴿١٩﴾ اِنَّهُمْ اِنْ يَظْهَرُوا عَلَيْكُمْ يَرْجُمُوكُمْ اَوْ يُعِيدُوكُمْ فِي مِلَّتِهِمْ وَلَنْ تُفْلِحُٓوا اِذًا اَبَدًا ﴿٢٠﴾ وَكَذٰلِكَ اَعْثَرْنَا عَلَيْهِمْ لِيَعْلَمُٓوا اَنَّ وَعْدَ اللّٰهِ حَقٌّ وَاَنَّ السَّاعَةَ لَا رَيْبَ فِيهَاۚ اِذْ يَتَنَازَعُونَ بَيْنَهُمْ اَمْرَهُمْ

---

(yatan halda) **görsəydin, hər halda qorxu səni bürüyüb, dəhşətdən dönüb qaçardın.**

**19)** (وَكَذٰلِكَ بَعَثْنَاهُمْ لِيَتَسَٓاءَلُوا بَيْنَهُمْ) **-** (ey Məhəmməd, əshabi-Kəhfi öz kamil qüdrətimizlə yatırıb onların bədənini qoruduğumuz kimi) **habelə** (öz qüdrətimizlə) **onları dirildib, həyat verdik ki, bir-birilərinə sual verib** (hal-əhval tutub ibrət alsınlar, Allah-Təalanın qüdrət və əzəmətini anlasınlar)**.** (قَالَ قَٓائِلٌ مِنْهُمْ كَمْ لَبِثْتُمْ) – (Allah-Təala onları yuxudan oyatdıqda, bir-birilərinə baxıb özlərinin dəyişmiş olduğunu gördülər)**, onlardan biri dedi: "Nə qədər** (yatıb) **qalıbsınız?"** (قَالُوا لَبِثْنَا يَوْمًا اَوْ بَعْضَ يَوْمٍ) **-** (sübhdən bir qədər sonra yatmağa başladıqlarına görə bəzisi) **dedi: "Bir gün qalmışıq",** (ondan sonra baxıb gördülər ki, günəş hələ batmayıbdır, dedilər:) **bir gündən az** (yatmışıq)**.** (قَالُوا رَبُّكُمْ اَعْلَمُ بِمَا لَبِثْتُمْ) – (onların bəzisi özlərinə baxıb çox dəyişdiklərini görəndə)**, dedilər:** (siz deyən kimi deyil, bəlkə) **nə qədər** (yatıb) **qaldığımızı rəbbimiz Allah-Təala bilir.** (Bizim buna dair bir elmimiz yoxdur. İndi bizə aclıq təsir edib, bizə yemək lazımdır)**.** (فَابْعَثُٓوا اَحَدَكُمْ بِوَرِقِكُمْ هٰذِهٓ اِلَى الْمَدِينَةِ) – **içinizdən birinə bu gümüş pulu verib şəhərə göndərin,** (فَلْيَنْظُرْ اَيُّهَٓا اَزْكٰى طَعَامًا) **- baxıb görsün ki,** (şəhər əhlindən) **hansı birinin pak və pakizə yeməyi var?** (فَلْيَأْتِكُمْ بِرِزْقٍ مِنْهُ) **– sizə o ruzidən gətirsin.** (وَلْيَتَلَطَّفْ) – (o şəhərə gedən şəxs diqqət edib (özünü tanıtmasın)**,** (وَلَا يُشْعِرَنَّ بِكُمْ اَحَدًا) – (elə rəftar etsin ki,) **heç kimə haqqınızda xəbər verməsin.**

**20)** (اِنَّهُمْ اِنْ يَظْهَرُوا عَلَيْكُمْ يَرْجُمُوكُمْ) **- əgər onlar sizdən xəbərdar olsalar, hər halda gəlib sizi daşqalaq edib öldürərlər,** (اَوْ يُعِيدُوكُمْ فِي مِلَّتِهِمْ) **- ya da sizi öz dinlərinə** (bütpərəstliyə) **qaytaracaqlar.** (وَلَنْ تُفْلِحُٓوا اِذًا اَبَدًا) **- o vaxt da əlbəttə, heç vaxt nicat tapmazsınız.** (Yemək gətirməsi üçün Təmlixanı şəhərə göndərdilər)**.**

**21)** (وَكَذٰلِكَ اَعْثَرْنَا عَلَيْهِمْ) – (necə ki onları yatızdırıb, sonra oyadıb canlarını aldıq)**, habelə** (xalqı) **onların əhvalından xəbərdar etdik,** (لِيَعْلَمُٓوا اَنَّ وَعْدَ اللّٰهِ حَقٌّ وَاَنَّ السَّاعَةَ لَا رَيْبَ فِيهَا اِذْ يَتَنَازَعُونَ بَيْنَهُمْ اَمْرَهُمْ) **– ta ki, agah olsunlar ki, Allah-Təalanın vədi haqdır və həqiqətən, qiyamət günü vaqe olacaq, onda heç bir şəkk və şübhə yoxdur. O zaman** (əhali də) **öz aralarında onların işi barəsində mübahisə edib** (bəzisi deyirdi ki, ancaq ruhlar diriləcək, bəzisi deyirdi ki, ruhlar bədənlə birlikdə diriləcək. Bəzisi də qiyaməti tamam in-

فَقَالُوا ابْنُوا عَلَيْهِمْ بُنْيَانًا رَبُّهُمْ اَعْلَمُ بِهِمْ قَالَ الَّذِينَ غَلَبُوا عَلٰى اَمْرِهِمْ لَنَتَّخِذَنَّ عَلَيْهِمْ مَسْجِدًا
﴿٢١﴾ سَيَقُولُونَ ثَلٰثَةٌ رَابِعُهُمْ كَلْبُهُمْ وَيَقُولُونَ خَمْسَةٌ سَادِسُهُمْ كَلْبُهُمْ رَجْمًا بِالْغَيْبِ وَيَقُولُونَ
سَبْعَةٌ وَثَامِنُهُمْ كَلْبُهُمْ قُلْ رَبّٖيٓ اَعْلَمُ بِعِدَّتِهِمْ مَا يَعْلَمُهُمْ اِلَّا قَلٖيلٌ فَلَا تُمَارِ فٖيهِمْ اِلَّا مِرَآءً ظَاهِرًا

---

kar edirdi. Belə bir zamanda əshabi-kəhfi yuxudan oyatdıq ki, camaat da Allah-Təalanın vədinin haqq olduğundan xəbərdar olsun). (فَقَالُوا ابْنُوا عَلَيْهِمْ بُنْيَانًا) – (əshabi- kəhflə görüşməyə gedən padşahla, vəzirlər onların öldüyünü görəndə bir-birilərinə) **dedilər:** (bunların mağaralarının qapısını bağlayıb) **üzərində** (möhkəm) **bir bina tikin** (ki, orada qorunmuş halda qalsınlar, ondan sonra padşahın hökmüylə mağaranın qapısını möhkəm bağladılar). (رَبُّهُمْ اَعْلَمُ بِهِمْ) - (ey Məhəmməd, əshabi-kəhfin) **rəbbi olan Allah-Təala onların əhvalına agahdır.** (Onların barəsində çox sözlər deyiblər, amma həqiqətən, Allah-Təaladan başqa heç kim onların əhvalatından tam agah deyil). (قَالَ الَّذِينَ غَلَبُوا عَلٰى اَمْرِهِمْ لَنَتَّخِذَنَّ عَلَيْهِمْ مَسْجِدًا) **- onların işləri haqqında** (mübahisə edib) **qalib olanlar** (Allah-Təalaya iman gətirənlər) **dedilər: "Əlbəttə, gərək biz** (burada, məzarları) **üstündə bir məscid tikək."** (Dediklərinə görə, orada bir məscid tikdilər. Camaatın əshabi-kəhfin sayı barəsində etdikləri ixtilaf sıradakı ayədə bəyan edilir).

**22)** (سَيَقُولُونَ ثَلٰثَةٌ رَابِعُهُمْ كَلْبُهُمْ) – (ey Məhəmməd, camaat onların sayı haqda ixtilaf edib bəzisi) **deyəcək:** (əshabi-Kəhf) **3 nəfərdir, 4-cüsü itləridir.** (وَيَقُولُونَ خَمْسَةٌ سَادِسُهُمْ كَلْبُهُمْ رَجْمًا بِالْغَيْبِ) – (bəzisi) **deyir ki: 5 nəfərdirlər, 6-cısı itləridir.** (Bu sözləri deməklə sanki) **qeybə daş atırlar,** (halbuki daşları nişana dəyməz). (وَيَقُولُونَ سَبْعَةٌ وَثَامِنُهُمْ كَلْبُهُمْ) – (bəzisi də) **deyir ki, 7 nəfərdirlər, 8-cisi itləridir.** (قُلْ رَبّٖيٓ اَعْلَمُ بِعِدَّتِهِمْ) - (ey Məhəmməd)**, de ki, mənim rəbbim Allah-Təala onların sayından daha çox agahdır,** (مَا يَعْلَمُهُمْ اِلَّا قَلٖيلٌ) – (insanlardan isə) **bunu bilən çox azdır.** (3 və 5 nəfər deyənlərin sözlərini nəql edəndən sonra buyurdu ki, bunlar qeybə daş atırlar. Amma bu sözü 7 nəfər deyənlərə isnad etməməsindən belə məlum olur ki, əshabi-kəhfin sayı 7 nəfərdir). (فَلَا تُمَارِ فٖيهِمْ اِلَّا مِرَآءً ظَاهِرًا) – (ey Məhəmməd, əshabi-Kəhf haqqında sənə sual verən müşriklərlə) **ancaq açıq-aşkar dəlillər** (vəhylə bildirilənlər) **istisna olmaqla mübahisə etmə,***

*(*Qeyd: Allah nə böyükdür! Müsəlmanlar və başqaları bir bu ayəyə fikir verib diqqətlə baxsınlar, görəsən, bundan artıq insanlıq olar ki, Allah-Təala öz peyğəmbərinə tövsiyə edir? Hz. Peyğəmbər də, əlbəttə, bu tövsiyədən bir zərrə qədər kənara çıxmayıbdır. Bir yerdə ki, Allah-Təala müşriklərlə belə rəftar etməyi tövsiyə etsin, görəsən, kitab əhli olan xristian və yəhudilərlə necə rəftar etməyi əmr edir? Bəs Qurana fikir verənlər niyə bu tövsiyəni tərk edib, anlamırlar ki, islam ümmətinə zərərli olan şey zimmilər (əhli-kitab) üçün də zərərlidir? O zərəri özündən dəf edən islam ümməti, gərək, kitab əhlindən də zərəri dəf etsin, özü üçün istədiyi xeyri gərək kitab əhlindən*

وَلَا تَسْتَفْتِ فِيهِمْ مِنْهُمْ اَحَدًا ﴿٢٢﴾ وَلَا تَقُولَنَّ لِشَايْءٍ اِنِّي فَاعِلٌ ذٰلِكَ غَدًاۙ ﴿٢٣﴾ اِلَّٓا اَنْ يَشَٓاءَ اللّٰهُۘ
وَاذْكُرْ رَبَّكَ اِذَا نَسِيتَ وَقُلْ عَسٰٓى اَنْ يَهْدِيَنِ رَبِّي لِاَقْرَبَ مِنْ هٰذَا رَشَدًا ﴿٢٤﴾ وَلَبِثُوا فٖي كَهْفِهِمْ
ثَلٰثَ مِائَةٍ سِنٖينَ وَازْدَادُوا تِسْعًا ﴿٢٥﴾

---

*də ötrü istəsin. İslam qanuna əsasən müsəlmanlarla kitab əhli arasında heç bir ədavət yoxdur, əksinə ittifaq - onlarla oturub durmaq, yeməklərini yemək, onlardan qız almaq və s. tövsiyə edilir. Bundan artıq nə ola bilər? İslam ümməti ilə kitab əhli arasında olan ədavətlərin hamısı hakimiyyət üstündə, dünya malı üstündə meydana gəlmişdir. Belə ədavət bir millətin öz içində də ola bilər. Necə ki xristian və islam millətləri öz içlərində bir-biriləri ilə açıq-aşkar ədavət edirlər. İslam ümməti, gərək, öz peyğəmbərlərindən nümunə alıb bütün millətlərlə gözəl rəftar etsinlər, nəinki özləri bir-biriləri ilə vəhşi heyvan kimi rəftar etsinlər. Diqqətlə baxanda onların sadəcə adlarının müsəlman olduğunu, amma özlərinin dinsiz, fitnə-fəsadçı şəxslərə oxşadığı görülür. Müsəlmanlar, gərək, zülmü, fitnə-fəsadı, oğurluğu tərk edib, bağışlamağı, mülayimliyi, namuslu olmağı özlərinə şüar etsinlər. Müsəlmanların düçar olduğu bədbəxtlikləri yazmaqdan yoruldum).*

(onları cahilliklə günahlandırıb məzəmmət etmə, xoş rəftar et). (وَلَا تَسْتَفْتِ فِيهِمْ مِنْهُمْ اَحَدًا) – (əshabi-Kəhf barəsində müşriklərin) **heç birindən bir şey soruşma,** (onlar sənə pis cavab verəndə sən də onlara cavab qaytarıb istehza edirsən, bu Allah-Təalanın sənə etdiyi tövsiyəyə ziddir. Gərək sən onlarla xoş rəftar edib günahlarından keçəsən)**.**

**23-24)** (وَلَا تَقُولَنَّ لِشَايْءٍ اِنِّي فَاعِلٌ ذٰلِكَ غَدًا اِلَّا اَنْ يَشَاءَ اللّٰهُ) **-** (Qüreyş camaatı gedib bir şeylər öyrənirdilər, sonra da Hz. Peyğəmbərdən soruşurdular ki, onu məğlub etsinlər. Yəhudilər dedilər: "Ruhun həqiqətini, bir də əshabi-Kəhflə, Zülqərneynin əhvalatını peyğəmbərdən soruşun." Soruşdular, Hz. Peyğəmbər buyurdu: "Sabah gəlin, sizə xəbər verim", bu sözü onlara deyib "inşallah" (əgər Allah-Təala istəsə) demədi. Bu səbəbdən vəhy təxirə düşüb o da cavab verə bilmədi, Qüreyş camaatı da onun peyğəmbərliyini təkzib etdilər. Allah-Təala Hz. Peyğəmbəri tənbeh edəndən sonra bu surə nazil oldu. Bu ayədə Hz. peyğəmbərə buyurur: etmək istədiyin şey barəsində) **onu sabah edəcəyəm demə, ancaq** (o işi Allah-Təalaya həvalə edib) **inşallah edəcəyəm, de.** (Qüdrət və ixtiyar Allah-Təalanın əlindədir. Səndə o qüdrət olmaya-olmaya, necə deyə bilərsən ki, mən o şeyi edərəm?) (وَاذْكُرْ رَبَّكَ اِذَا نَسِيتَ) – (hər dəfə inşallah deməyi) **unutduqda,** (harda və nə vaxt olursa olsun)**, rəbbin Allah-Təalanı zikr edib** (inşallah de)**.** (وَقُلْ عَسٰى اَنْ يَهْدِيَنِ رَبِّي لِاَقْرَبَ مِنْ هٰذَا رَشَدًا) - (ey Məhəmməd)**, de ki, rəbbim Allah-Təalanın mənə bundan** (əshabi-kəhf xəbərləri haqqında) **doğruya daha yaxın** (dəlil və sübut verib) **hidayət edəcəyinə ümidvaram.**

**25)** (وَلَبِثُوا فِي كَهْفِهِمْ ثَلٰثَ مِائَةٍ سِنِينَ وَازْدَادُوا تِسْعًا) **- əshabi-kəhf mağarada (yatdıqları halda) 300 il və əlavə olaraq 9 il** (309 il) **qaldılar.**

قُلِ اللّٰهُ اَعْلَمُ بِمَا لَبِثُواۚ لَهُ غَيْبُ السَّمٰوَاتِ وَالْاَرْضِۜ اَبْصِرْ بِهٖ وَاَسْمِعْۜ مَا لَهُمْ مِنْ دُونِهٖ مِنْ وَلِيٍّۘ وَلَا
يُشْرِكُ فِي حُكْمِهٖٓ اَحَدًا ﴿٢٦﴾ وَاتْلُ مَٓا اُوحِيَ اِلَيْكَ مِنْ كِتَابِ رَبِّكَۚ لَا مُبَدِّلَ لِكَلِمَاتِهٖ وَلَنْ تَجِدَ مِنْ
دُونِهٖ مُلْتَحَدًا ﴿٢٧﴾ وَاصْبِرْ نَفْسَكَ مَعَ الَّذِينَ يَدْعُونَ رَبَّهُمْ بِالْغَدٰوةِ وَالْعَشِيِّ يُرِيدُونَ وَجْهَهُ وَلَا
تَعْدُ عَيْنَاكَ عَنْهُمْۚ تُرِيدُ زِينَةَ الْحَيٰوةِ الدُّنْيَا وَلَا تُطِعْ مَنْ اَغْفَلْنَا قَلْبَهُ عَنْ ذِكْرِنَا وَاتَّبَعَ هَوٰيهُ وَكَانَ اَمْرُهُ
فُرُطًا ﴿٢٨﴾ وَقُلِ الْحَقُّ مِنْ رَبِّكُمْ

---

**26)** (قُلِ اللّٰهُ اَعْلَمُ بِمَا لَبِثُوا) - (ey Məhəmməd)**, xalqa de ki,** (əshabi-kəhfin yatıb qalması müddətində ixtilaf edib buna agah ola bilməzsiniz)**, ancaq Allah-Təala onların** (orada) **nə qədər qaldığını bilir.** (Necə ki xəbər verdi)**.** (لَهُ غَيْبُ السَّمٰوَاتِ وَالْاَرْضِ) **- səmaların və yerin qeybini** (insanlara qaib olan aləmləri bilmək) **Allah-Təalaya məxsusdur.** (İnsanlar qeybdən xəbərdar ola bilməzlər)**.** (اَبْصِرْ بِهٖ وَاَسْمِعْ) **- Allah-Təala hər bir şeyi ən yaxşı eşidib görəndir** (Heç bir şey Ona məxfi qalmaz)**.** (مَا لَهُمْ مِنْ دُونِهٖ مِنْ وَلِيٍّ وَلَا يُشْرِكُ فِي حُكْمِهٖٓ اَحَدًا) **– onların** (səma və yer əhlinin) **Allah-Təaladan başqa heç bir köməkçisi yoxdur və heç kimi də öz hökmündə şərik etməz).**

**27)** (وَاتْلُ مَٓا اُوحِيَ اِلَيْكَ مِنْ كِتَابِ رَبِّكَ) - (ey Məhəmməd)**, o hökmlər ki, sənə rəbbin Allah-Təalanın kitabı** (Qurani-Şərifdən) **vəhy olunur,** (düz) **oxuyub** (camaata çatdır, Qüreyş camaatının sözlərinə - onun bəzi hökmlərini bizim üçün dəyişdir, deməlirinə qulaq asma)**.** (لَا مُبَدِّلَ لِكَلِمَاتِهٖ) **- Allah-Təalanın kəlmələrini** (Qurani-Şərifi) **dəyişdirən ola bilməz.** (وَلَنْ تَجِدَ مِنْ دُونِهٖ مُلْتَحَدًا) – (əgər Qurana tabe olmasan)**, Allah-Təaladan başqa bir sığınacaq tapa bilməzsən.**

**28)** (وَاصْبِرْ نَفْسَكَ مَعَ الَّذِينَ يَدْعُونَ رَبَّهُمْ بِالْغَدٰوةِ وَالْعَشِيِّ يُرِيدُونَ وَجْهَهُ) - (müşriklərin bəzi böyükləri Hz. peyğəmbərə dedilər: "Yoxsul şəxsləri, məsələn, Süheybi, Əmmarı, Bilalı, Xabbabı və digərlərini özündən uzaqlaşdır ki, biz sənin yanına gəlib oturub danışaq." Hz. peyğəmbər onların iman etməsini çox istədiyindən bu təklifi bəyəndi. O vaxt da bu ayə nazil oldu. Ayənin mənası belədir, buyurur: "ey Məhəmməd)**, səhər-axşam Allaha dua** (ibadət) **edib ancaq onu istəyən** (yoxsul) **şəxslərlə bir yerdə (oturub) özünü səbirə** (dözməyə) **vadar edib** (onları evindən qovma)**.** (وَلَا تَعْدُ عَيْنَاكَ عَنْهُمْ تُرِيدُ زِينَةَ الْحَيٰوةِ الدُّنْيَا) **-** (ey Məhəmməd)**, dünya həyatının zinətini** (zənginlərlə bir yerdə oturub söhbət etməyi) **istəyərək gözlərini** (yoxsul möminlərdən təşəxxüslü zəngin şəxslərə tərəf) **çevirmə.** (وَلَا تُطِعْ مَنْ اَغْفَلْنَا قَلْبَهُ عَنْ ذِكْرِنَا وَاتَّبَعَ هَوٰيهُ وَكَانَ اَمْرُهُ فُرُطًا) **-** (ey Məhəmməd, qəbih əməlinə görə) **qəlbini bizi zikr etməkdən qafil etdiyimiz, nəfsani arzularına tabe olub** (haqdan vaz keçib) **işində ifrata varan şəxslərə** (müşriklərə) **itaət etmə.**

**29)** (وَقُلِ الْحَقُّ مِنْ رَبِّكُمْ) – (ey Məhəmməd, müşriklərə) **de ki, rəbbiniz Allah-Təala tərəfindən haqq** (aşkar olub batil gedibdir. İndi ixtiyar sizindir.

فَمَنْ شَآءَ فَلْيُؤْمِنْ وَمَنْ شَآءَ فَلْيَكْفُرْ اِنَّآ اَعْتَدْنَا لِلظَّالِمِينَ نَارًا اَحَاطَ بِهِمْ سُرَادِقُهَا وَاِنْ يَسْتَغِيثُوا
يُغَاثُوا بِمَآءٍ كَالْمُهْلِ يَشْوِي الْوُجُوهَ بِئْسَ الشَّرَابُ وَسَآءَتْ مُرْتَفَقًا ﴿٢٩﴾ اِنَّ الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا
الصَّالِحَاتِ اِنَّا لَا نُضِيعُ اَجْرَ مَنْ اَحْسَنَ عَمَلًا ﴿٣٠﴾ اُولٰئِكَ لَهُمْ جَنَّاتُ عَدْنٍ تَجْرِي مِنْ تَحْتِهِمُ
الْاَنْهَارُ يُحَلَّوْنَ فِيهَا مِنْ اَسَاوِرَ مِنْ ذَهَبٍ وَيَلْبَسُونَ ثِيَابًا خُضْرًا مِنْ سُنْدُسٍ وَاِسْتَبْرَقٍ مُتَّكِئِينَ فِيهَا
عَلَى الْاَرَآئِكِ نِعْمَ الثَّوَابُ وَحَسُنَتْ مُرْتَفَقًا ﴿٣١﴾ وَاضْرِبْ لَهُمْ مَثَلًا رَجُلَيْنِ جَعَلْنَا لِاَحَدِهِمَا
جَنَّتَيْنِ مِنْ اَعْنَابٍ وَحَفَفْنَاهُمَا بِنَخْلٍ وَجَعَلْنَا بَيْنَهُمَا زَرْعًا ﴿٣٢﴾

---

İstəyirsiniz nicat yolunu, ya da asilik və məhv olma yolunu seçin, ixtiyar sizindir). (فَمَنْ شَاءَ فَلْيُؤْمِنْ وَمَنْ شَاءَ فَلْيَكْفُرْ) – **kim istəyir,** (öz ixtiyarıyla) **mömin olsun, kim də istəyir,** (öz ixtiyarıyla) **kafir olsun,** (bizə bir zərəri yoxdur). (اِنَّا اَعْتَدْنَا لِلظَّالِمِينَ نَارًا اَحَاطَ بِهِمْ سُرَادِقُهَا) - **həqiqətən, biz** (axirətdə) **zalımlardan ötrü elə bir od hazırlamışıq ki, onun pərdələri** (çadırın ətrafına çəkilən pərdə kimi) **onları əhatə edib** (heç vaxt o cəhənnəm odundan xilas ola bilməzlər). (وَاِنْ يَسْتَغِيثُوا يُغَاثُوا بِمَاءٍ كَالْمُهْلِ) - **əgər** (cəhənnəm əhli susuzluq atəşindən) **ah-nalə edib** (su istəsələr, onlara əvəzində) **ərinmiş mədənlər kimi qaynar su verilər.** (يَشْوِي الْوُجُوهَ) – (o su) **üzlərini** (kabab kimi) **yandırıb** (dəriləri tökülər). (بِئْسَ الشَّرَابُ وَسَاءَتْ مُرْتَفَقًا) – **o** (su) **nə pis içkidir və o** (cəhənnəm) **nə pis məskəndir.**

**30)** (اِنَّ الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ اِنَّا لَا نُضِيعُ اَجْرَ مَنْ اَحْسَنَ عَمَلًا) - **həqiqətən,** (Qurana) **iman gətirib, yaxşı, gözəl əməllər edənlərin mükafatını zay etmərik.** (Bəlkə ən yaxşı şəkildə verərik).

**31)** (اُولٰئِكَ لَهُمْ جَنَّاتُ عَدْنٍ تَجْرِي مِنْ تَحْتِهِمُ الْاَنْهَارُ) – (yaxşı əməl edən) **onlardan ötrü** (axirətdə qəsrlərinin və ağaclarının) **altından çaylar axan** (əbədi) **Ədn bağları var.** (يُحَلَّوْنَ فِيهَا مِنْ اَسَاوِرَ مِنْ ذَهَبٍ) - **onlara behiştdə qızıldan qolbaqlar verilər.** (Xəyal etməyin ki, bu dünyada qadınlara məxsus olan qolbağdır, bu heç bir xəyala gəlməyən qolbağdır). (وَيَلْبَسُونَ ثِيَابًا خُضْرًا مِنْ سُنْدُسٍ وَاِسْتَبْرَقٍ) – **nazik və qalın yaşıl ipək libaslar geyərlər.** (مُتَّكِئِينَ فِيهَا عَلَى الْاَرَائِكِ) – (behiştdə) **taxtlara oturub söykənərlər,** (bəli, nemət içində rahatlıqla oturub istirahət edərlər). (نِعْمَ الثَّوَابُ وَحَسُنَتْ مُرْتَفَقًا) – **o** (axirətin əcri və savabı) **nə yaxşı, gözəl əcr və savabdır. O** (behiştdə olan qəsrlər və taxtlar) **nə yaxşı məkandır.**

**32)** (وَاضْرِبْ لَهُمْ مَثَلًا رَجُلَيْنِ) - (ey Məhəmməd, mömin və kafirdən ötrü) **iki kişinin əhvalatını misal gətir.** (Biri zəngin, o biri yoxsul mömin idi), (جَعَلْنَا لِاَحَدِهِمَا جَنَّتَيْنِ مِنْ اَعْنَابٍ) - **onlardan birinə** (kafirə) **iki üzüm bağı verdik.** (وَحَفَفْنَاهُمَا بِنَخْلٍ) – (o iki bağın ətrafını) **xurma** (ağacları) **ilə** (divar kimi) **əhatə etdik.** (وَجَعَلْنَا بَيْنَهُمَا زَرْعًا) – (o iki bağın) **arasına** (hər cür meyvə və səbzələri olan gözəl) **əkin saldıq.**

كِلْتَا الْجَنَّتَيْنِ اٰتَتْ اُكُلَهَا وَلَمْ تَظْلِمْ مِنْهُ شَيْـًٔاۙ وَفَجَّرْنَا خِلَالَهُمَا نَهَرًاۙ ﴿٣٣﴾ وَكَانَ لَهُ ثَمَرٌۚ فَقَالَ لِصَاحِبِه
وَهُوَ يُحَاوِرُهُ اَنَا اَكْثَرُ مِنْكَ مَالًا وَاَعَزُّ نَفَرًا ﴿٣٤﴾ وَدَخَلَ جَنَّتَهُ وَهُوَ ظَالِمٌ لِنَفْسِهۚ قَالَ مَٓا اَظُنُّ اَنْ تَبِيدَ
هٰذِهٓ اَبَدًاۙ ﴿٣٥﴾ وَمَٓا اَظُنُّ السَّاعَةَ قَٓائِمَةًۙ وَلَئِنْ رُدِدْتُ اِلٰى رَبِّي لَاَجِدَنَّ خَيْرًا مِنْهَا مُنْقَلَبًا ﴿٣٦﴾ قَالَ
لَهُ صَاحِبُهُ وَهُوَ يُحَاوِرُهُ اَكَفَرْتَ بِالَّذِي خَلَقَكَ مِنْ تُرَابٍ ثُمَّ مِنْ نُطْفَةٍ ثُمَّ سَوّٰيكَ رَجُلًاؕ ﴿٣٧﴾ لٰكِنَّا
هُوَ اللّٰهُ رَبِّي وَلَٓا اُشْرِكُ بِرَبّٖٓي اَحَدًا ﴿٣٨﴾ وَلَوْلَٓا اِذْ دَخَلْتَ جَنَّتَكَ قُلْتَ مَا شَٓاءَ اللّٰهُۙ لَا قُوَّةَ اِلَّا بِاللّٰهِۚ

---

**33)** (كِلْتَا الْجَنَّتَيْنِ اٰتَتْ اُكُلَهَا) **- o bağların hər ikisi tam şəkildə** (meyvə) **məhsulu verdi.** (وَلَمْ تَظْلِمْ مِنْهُ شَيْـًٔا وَفَجَّرْنَا خِلَالَهُمَا نَهَرًا) – (o bağların heç bir meyvəsini) **əskik etməyib,** (o iki bağın) **arasından çaylar axıtdıq.**

**34)** (وَكَانَ لَهُ ثَمَرٌ) – (bağ sahibinin bağdan başqa da) **çoxlu malı var idi.** (فَقَالَ لِصَاحِبِه وَهُوَ يُحَاوِرُهُ) **- mömin yoldaşı ilə danışarkən ona belə dedi:** (اَنَا اَكْثَرُ مِنْكَ مَالًا وَاَعَزُّ نَفَرًا) – (sənin dünya malından heç bir şeyin yoxdur), **mənim səndən var-dövlətim daha artıq və köməkçilərim də daha çoxdur.**

**35)** (وَدَخَلَ جَنَّتَهُ وَهُوَ ظَالِمٌ لِنَفْسِهۚ) – (Allah-Təalanın nemətlərinə qarşı nankor və) **özünə zalım olduğu halda** (təkəbbürlə öz mömin yoldaşının əlindən tutub) **bağa daxil oldu.** (قَالَ مَٓا اَظُنُّ اَنْ تَبِيدَ هٰذِهٓ اَبَدًا) – (bağda olan nemətlərə baxıb, təkəbbürlə) **dedi: zənn etmirəm ki, bu** (bağ və bu nemətlər) **nə vaxtsa, yox olsun.**

**36)** (وَمَٓا اَظُنُّ السَّاعَةَ قَٓائِمَةً) **- bir də zənn etmirəm ki,** (o dediyiniz) **qiyamət qopsun,** (وَلَئِنْ رُدِدْتُ اِلٰى رَبِّي لَاَجِدَنَّ خَيْرًا مِنْهَا مُنْقَلَبًا)**- əgər** (qiyamət olub), **rəbbim Allah-Təalanın hüzuruna qayıtsam, özümə bundan da yaxşı məskən** (qayıdış yeri) **taparam.** (Necə ki dünyada mənə belə bağ verib, axirətdə bundan da yaxşısını verər).

**37)** (قَالَ لَهُ صَاحِبُهُ وَهُوَ يُحَاوِرُهُ) – (o kafirlə) **danışan** (mömin) **yoldaşı isə dedi:** (اَكَفَرْتَ بِالَّذِي خَلَقَكَ مِنْ تُرَابٍ ثُمَّ مِنْ نُطْفَةٍ) - (baban Adəmi) **torpaqdan, səni də spermadan yaradan Allah-Təalanı inkar edirsən?** (ثُمَّ سَوّٰيكَ رَجُلًا) – (hansı ki səni yaradandan sonra) **səni** (tam) **insan şəklinə salıbdır.**

**38)** (لٰكِنَّا هُوَ اللّٰهُ رَبِّي وَلَٓا اُشْرِكُ بِرَبّٖٓي اَحَدًا) – (əgər sən Allah-Təalanı inkar etsən), **lakin** (mən sən deyən sözləri deməyib Allah-Təalanı inkar etmərəm)**. Mənim rəbbim yeganə olan Allah-Təaladır və heç kimi rəbbim Allah-Təalaya şərik qoşmaram.**

**39)** (وَلَوْلَٓا اِذْ دَخَلْتَ جَنَّتَكَ قُلْتَ مَا شَٓاءَ اللّٰهُ لَا قُوَّةَ اِلَّا بِاللّٰهِ) – **kaş ki bağına daxil olub** (Allah-Təalanın verdiyi ruzilərə tamaşa edəndə) **- maşallah** (Allahın istədiyi olur, hər bir xeyir Allah-Təaladandır)**, Allahdan başqa, güc və qüvvət sahibi yoxdur, deyib** (Allah-Təalaya şükür edəydin. Nəinki Allah-Təalanın verdiyi

اِنْ تَرَنِ اَنَا اَقَلَّ مِنْكَ مَالًا وَوَلَدًاۚ ﴿٣٩﴾ فَعَسٰى رَبّ۪ٓي اَنْ يُؤْتِيَنِ خَيْرًا مِنْ جَنَّتِكَ وَيُرْسِلَ عَلَيْهَا حُسْبَانًا
مِنَ السَّمَٓاءِ فَتُصْبِحَ صَع۪يدًا زَلَقًاۙ ﴿٤٠﴾ اَوْ يُصْبِحَ مَٓاؤُ۬هَا غَوْرًا فَلَنْ تَسْتَط۪يعَ لَهُ طَلَبًا ﴿٤١﴾ وَاُح۪يطَ
بِثَمَرِه۪ فَاَصْبَحَ يُقَلِّبُ كَفَّيْهِ عَلٰى مَٓا اَنْفَقَ ف۪يهَا وَهِيَ خَاوِيَةٌ عَلٰى عُرُوشِهَا وَيَقُولُ يَا لَيْتَن۪ي لَمْ اُشْرِكْ
بِرَبّ۪ٓي اَحَدًا ﴿٤٢﴾ وَلَمْ تَكُنْ لَهُ فِئَةٌ يَنْصُرُونَهُ مِنْ دُونِ اللّٰهِ وَمَا كَانَ مُنْتَصِرًاۜ ﴿٤٣﴾ هُنَالِكَ الْوَلَايَةُ
لِلّٰهِ الْحَقِّۜ هُوَ خَيْرٌ ثَوَابًا وَخَيْرٌ عُقْبًاۜ ﴿٤٤﴾

---

nemətləri inkar edib kafir olaydın). (اِنْ تَرَنِ اَنَا اَقَلَّ مِنْكَ مَالًا وَوَلَدًا) – **hərçənd sən məni mal və övlad cəhətdən özündən əskik** (həqir) **görürsən.**

**40)** (فَعَسٰى رَبّ۪ٓي اَنْ يُؤْتِيَنِ خَيْرًا مِنْ جَنَّتِكَ) - **ümidvaram ki, rəbbim Allah-Təala sənin bu bağından daha yaxşı və gözəl bağı** (axirətdə) **mənə versin.** (وَيُرْسِلَ عَلَيْهَا حُسْبَانًا مِنَ السَّمَٓاءِ فَتُصْبِحَ صَع۪يدًا زَلَقًا) - **və** (nankorluq etdiyinə görə bu bağına) **səmadan bir bəla göndərib** (hamısını həlak edib yandırsın)**. Bağın qupquru torpaq olub,** (heç bir şey də bitməsin)**.**

**41)** (اَوْ يُصْبِحَ مَٓاؤُ۬هَا غَوْرًا) - **ya da** (Allah-Təalanın əmri ilə bağının) **suyu çəkilib getsin** (və bağın susuz qalıb qurusun)**.** (فَلَنْ تَسْتَط۪يعَ لَهُ طَلَبًا) - **o vaxt da səndə o qüdrət olmaz ki,** (bağını suvarmaq üçün su) **axtarıb tapasan.**

**42** (وَاُح۪يطَ بِثَمَرِه۪) - (ey Məhəmməd, Allah-Təala mömin şəxsin ümidini doğruldub, bağ sahibi nankorluq etdiyindən ona əzab göndərib o bağı yandırıb) **meyvələrini yox etdi.** (فَاَصْبَحَ يُقَلِّبُ كَفَّيْهِ عَلٰى مَٓا اَنْفَقَ ف۪يهَا وَهِيَ خَاوِيَةٌ عَلٰى عُرُوشِهَا) - **bağ sahibi** (kafir öz bağını o halda görəndə) **çəkdiyi xərcə görə əllərini bir-birinə sürtdü,** (necə ki peşman olan şəxs belə edər)**.** (Baxıb gördü ki,) **bağın çardaqları yerə çöküb** (hamısı yanıb məhv olubdur)**.** (وَيَقُولُ يَا لَيْتَن۪ي لَمْ اُشْرِكْ بِرَبّ۪ٓي اَحَدًا) – **o da** (əməllərinə peşman olub) **deyirdi: “kaş ki rəbbim Allah-Təalaya şərik qoşmayaydım.** (Onların mənə heç bir faydası olmadı)**.**

**43)** (وَلَمْ تَكُنْ لَهُ فِئَةٌ يَنْصُرُونَهُ مِنْ دُونِ اللّٰهِ) - **Allah-Təaladan başqa ona kömək edən** (qüdrətli cavan) **şəxslər də olmadı.** (Allah-Təala da onun küfrünə görə ona kömək etməyib köməksiz qaldı)**.** (وَمَا كَانَ مُنْتَصِرًا) - **o** (kafir) **özü də qüdrət sahibi olmayıb** (bağını Allah-Təalanın əzab və intiqamından qoruya bilmədi)**.**

**44)** (هُنَالِكَ الْوَلَايَةُ لِلّٰهِ الْحَقِّ) - **belə məqamda** (yəni kafirlərin malına bəla gələn məqamlarda) **haqq olan kömək Allah-Təalaya məxsusdur.** (Bu məqamda Allah-Təaladan başqa heç kim kömək edə bilməz)**.** (هُوَ خَيْرٌ ثَوَابًا وَخَيْرٌ عُقْبًا) – (bəndələrinə) **mükafat verməkdə və aqibətlərini gözəl etməkdə Allah-Təala yaxşıdır.**

وَاضْرِبْ لَهُمْ مَثَلَ الْحَيٰوةِ الدُّنْيَا كَمَٓاءٍ اَنْزَلْنَاهُ مِنَ السَّمَٓاءِ فَاخْتَلَطَ بِهٖ نَبَاتُ الْاَرْضِ فَاَصْبَحَ هَشٖيمًا
تَذْرُوهُ الرِّيَاحُۜ وَكَانَ اللّٰهُ عَلٰى كُلِّ شَيْءٍ مُقْتَدِرًا ﴿٤٥﴾ اَلْمَالُ وَالْبَنُونَ زٖينَةُ الْحَيٰوةِ الدُّنْيَاۚ وَالْبَاقِيَاتُ
الصَّالِحَاتُ خَيْرٌ عِنْدَ رَبِّكَ ثَوَابًا وَخَيْرٌ اَمَلًا ﴿٤٦﴾ وَيَوْمَ نُسَيِّرُ الْجِبَالَ وَتَرَى الْاَرْضَ بَارِزَةًۙ
وَحَشَرْنَاهُمْ فَلَمْ نُغَادِرْ مِنْهُمْ اَحَدًاۚ ﴿٤٧﴾ وَعُرِضُوا عَلٰى رَبِّكَ صَفًّاۜ لَقَدْ جِئْتُمُونَا كَمَا خَلَقْنَاكُمْ اَوَّلَ
مَرَّةٍۘ بَلْ زَعَمْتُمْ اَلَّنْ نَجْعَلَ لَكُمْ مَوْعِدًا ﴿٤٨﴾ وَوُضِعَ الْكِتَابُ فَتَرَى الْمُجْرِمٖينَ مُشْفِقٖينَ مِمَّا فٖيهِ

---

**45)** (وَاضْرِبْ لَهُمْ مَثَلَ الْحَيٰوةِ الدُّنْيَا) - (ey Məhəmməd, insanlara) **dünya həyatını misal çək.** (كَمَٓاءٍ اَنْزَلْنَاهُ مِنَ السَّمَٓاءِ فَاخْتَلَطَ بِهٖ نَبَاتُ الْاَرْضِ فَاَصْبَحَ هَشٖيمًا تَذْرُوهُ الرِّيَاحُ) – (ey Məhəmməd, onlara de ki, dünya həyatı bu ot kimidir:) **səmadan bir su göndərərik,** (o suyun səbəbinə) **hər cür ot göyərib bir-birinə qarışıb** (yer üzünə zinət verər)**. Bir müddətdən sonra isə** (o təzə otlar) **quruyub küləklər də onları dağıdıb çör-çöp edər.** (Dünya nemətləri də bu otlar kimi 5 günlük olub ondan ləzzət alarlar, əcəlləri gəldikdə isə ölüb, o nemətlər də başqalarına qalır. Özünə isə ancaq günahlarının əzabı qalar)**.** (وَكَانَ اللّٰهُ عَلٰى كُلِّ شَيْءٍ مُقْتَدِرًا) - **Allah-Təala hər bir şeyə** (yaratmağa və yox etməyə də) **qadirdir.**

**46)** (اَلْمَالُ وَالْبَنُونَ زٖينَةُ الْحَيٰوةِ الدُّنْيَا) - **dünya malı və oğullar dünya həyatının zinətidir.** (وَالْبَاقِيَاتُ الصَّالِحَاتُ خَيْرٌ عِنْدَ رَبِّكَ ثَوَابًا وَخَيْرٌ اَمَلًا) - (ey Məhəmməd)**, əbədi qalan saleh əməllər isə rəbbin Allah-Təalanın yanında savab və arzu olaraq** (onlardan) **yaxşıdır.**

**47)** (وَيَوْمَ نُسَيِّرُ الْجِبَالَ) – (qiyamət) **günü dağları** (yerindən) **qoparıb** (toz kimi havaya dağıdarıq)**.** (وَتَرَى الْاَرْضَ بَارِزَةً) – (ey Məhəmməd, ogünkü gündə) **yer üzünü dümdüz görərsən,** (bir şey olmaz ki, insan onun dalında gizlənsin)**.** (وَحَشَرْنَاهُمْ فَلَمْ نُغَادِرْ مِنْهُمْ اَحَدًا) – **onlardan heç kimi** (kənarda) **qoymayıb hamısını** (haqq-hesabdan ötrü) **bir yerə toplayarıq.**

**48)** (وَعُرِضُوا عَلٰى رَبِّكَ صَفًّا) – (ey Məhəmməd, o gün bütün insanlar) **rəbbin Allah-Təalanın hüzurunda səf-səf durarlar,** (necə ki qoşun sultanın hüzurunda durar)**.** (لَقَدْ جِئْتُمُونَا كَمَا خَلَقْنَاكُمْ اَوَّلَ مَرَّةٍ) – (o vaxt da onlara deyərik:) **necə ki sizi ilk dəfə yaratmışdıq,** (budur sizə yenidən həyat verib) **bizim tərəfimizə gəldiniz,** (بَلْ زَعَمْتُمْ اَلَّنْ نَجْعَلَ لَكُمْ مَوْعِدًا) - **bəlkə, siz güman etdiniz ki, sizə** (haqq-hesabdan ötrü) **verdiyimiz vədi yerinə yetirməyəcəyik,** (indi gördünüz ki, o gün vaqe oldu)**.**

**49)** (وَوُضِعَ الْكِتَابُ) - (ey Məhəmməd, qiyamət günündə hər bir şəxsin əməl) **kağızı onun** (əlinə) **qoyular.** (فَتَرَى الْمُجْرِمٖينَ مُشْفِقٖينَ مِمَّا فٖيهِ) – (ey Məhəmməd, o vaxt da hər kəs öz kağızını oxuyar, o gün) **günahkarların** (o kağızda olan günahlardan) **qorxduğunu görərsən,** (dünyada hər bir zəruri şey kağıza yazılıb saxlandığından Allah-Təala axirət əməllərinin kağıza yazıldığını misal

وَيَقُولُونَ يَا وَيْلَتَنَا مَا لِهٰذَا الْكِتَابِ لَا يُغَادِرُ صَغِيرَةً وَلَا كَبِيرَةً اِلَّٓا اَحْصٰيهَاۚ وَوَجَدُوا مَا عَمِلُوا حَاضِرًاۜ وَلَا يَظْلِمُ رَبُّكَ اَحَدًا ﴿٤٩﴾ وَاِذْ قُلْنَا لِلْمَلٰٓئِكَةِ اسْجُدُوا لِاٰدَمَ فَسَجَدُٓوا اِلَّٓا اِبْلِيسَۜ كَانَ مِنَ الْجِنِّ فَفَسَقَ عَنْ اَمْرِ رَبِّهٖۜ اَفَتَتَّخِذُونَهُ وَذُرِّيَّتَهُ اَوْلِيَٓاءَ مِنْ دُونٖي

---

çəkir). (وَيَقُولُونَ يَا وَيْلَتَنَا مَالِ هٰذَا الْكِتَابِ) – (günahkarlar kağızlarını oxuyandan sonra) **deyərlər: “Vay halımıza,** (yəni həlak olduq, daha bizə qurtuluş olmaz)**, nə olubdur, bu necə kağızdır ki,** (لَا يُغَادِرُ صَغِيرَةً وَلَا كَبِيرَةً اِلَّٓا اَحْصٰيهَا) – **böyük, ya da kiçik** (günahlarımızdan) **heç bir şey buraxmayıb, hamısını sayıb saxlayıbdır.”** (وَوَجَدُوا مَا عَمِلُوا حَاضِرًا) - (ey Məhəmməd, qiyamət günü) **onlar etdikləri əməlləri** (qarşılarında) **hazır görərlər.** (وَلَا يَظْلِمُ رَبُّكَ اَحَدًا) **- sənin rəbbin Allah-Təala heç kimə zülm etməyib** (əməllərindən artıq onlara əzab etməz)**.**

**50)** (وَاِذْ قُلْنَا لِلْمَلٰٓئِكَةِ اسْجُدُوا لِاٰدَمَ فَسَجَدُٓوا اِلَّٓا اِبْلِيسَ) - (ey Məhəmməd)**, biz mələklərə - Adəmə səcdə edin, dedikdə İblisdən** (xəbis nəfsi-əmmarədən) **başqa hamısı** (ruhani qüvvələr) **səcdə etdilər,** (كَانَ مِنَ الْجِنِّ فَفَسَقَ عَنْ اَمْرِ رَبِّهٖ) – (İblis və ya şeytan) **cinlərdən idi** (Allah-Təalanın itaətindən kənar olan cin tayfasından idi, qəzəb, hirs, şəhvət, hərislik, zülm və s. xüsusiyyətlərə sahib olduğundan fasiq olub Allah-Təalanın itaətindən çıxdı). (اَفَتَتَّخِذُونَهُ وَذُرِّيَّتَهُٓ اَوْلِيَٓاءَ مِنْ دُونٖي) – (siz Adəm övladı)**, siz məni qoyub şeytanı və övladını*** (özünüzə) **dost tutursunuz?**

*(*Qeyd: Şeytandan (xəbis nəfsi-əmmarədən) məqsəd ondan meydana gələn xəbis sifətlərdir. Əşəri məzhəbi alimlərinin şeytanın necə övladı olması haqqında bəzi sözləri var ki, oğlu ölən ana o sözlərdən gülər. Özlərini təfsirçi sayanlar yalançı ravilərin (rəvayət edənlərin) mənasız sözlərini qəbul edib Hz. Peyğəmbərə isnad ediblər. Şeytanın övladı haqqında onların dedikləri sözləri qeyd edək. Belə ki, bu kitaba baxanlar ibrət alıb Allah-Təalaya və onun peyğəmbəri olan Hz. Məhəmmədə (əs.,) isnad etdikləri yalan sözlərdən agah olsunlar. Onlardan bəzisi deyib ki, şeytanın övladı insan kimi doğulur, amma şeytanın arvadı haradandır? O məlum deyil, bəzisi deyib ki, şeytan quyruğunu öz altına salıb sonra yumurtlayar. (Həqiqətən, şeytanın yumurtası, gərək, dadlı olsun, görəsən, bu sözü deyənlər onun yumurtasının dadına baxıbmı?) Guya hər dəfə bir yumurtası açılıb, oradan bir dəstə şeytan çıxar. Bu sözləri deyənlərin sözü çox təəccüblüdür. Gah da deyirlər ki, şeytan mələkdir. Halbuki onun cin olduğunu Allah-Təala Qurani-Şərifdə xəbər verir. Bunu qəbul etməyib deyirlər ki, tülkü kimi quyruqlu olub, çanaqlı bağa kimi yumurtlayır. Bəziləri də deyir ki, şeytanın oğulları var, adlarını da qeyd ediblər: 1-Laqis 2-Əlhan 3-İlhifaf 4-Mürrə 5-Zələnbur, 6- Sebr, 7-Avər, 8-Müvəsvis, 9-Dasim. Bunların hər biri insana vəsvəsə etməkdə ayrı bir elmlə məşğuldur. Şeytana bu qədər oğul isnad etməkdə məqsədləri budur ki, insanların sayı çox olduğundan şeytanlar da gərək, çox olsunlar. Belə ki, vəsvəsə etməyə vaxtları çatsın. Amma bundan qafildirlər ki, şeytanın 9 oğlu bütün insanlara kifayət etməz. Yalan dediklərinə görə, ravi adı çəkməyib, - belə deyilib, deyirlər. Amma Hz. Peyğəmbərdən nəql olunan haqq sözü unudublar. Buyurur: “Hər şəxsin özünün bir*

وَهُمْ لَكُمْ عَدُوٌّ ۜ بِئْسَ لِلظَّالِمِينَ بَدَلًا ﴿٥٠﴾ مَٓا اَشْهَدْتُهُمْ خَلْقَ السَّمٰوَاتِ وَالْاَرْضِ وَلَا خَلْقَ
اَنْفُسِهِمْ ۖ وَمَا كُنْتُ مُتَّخِذَ الْمُضِلِّينَ عَضُدًا ﴿٥١﴾ وَيَوْمَ يَقُولُ نَادُوا شُرَكَٓاءِيَ الَّذِينَ زَعَمْتُمْ
فَدَعَوْهُمْ فَلَمْ يَسْتَجِيبُوا لَهُمْ وَجَعَلْنَا بَيْنَهُمْ مَوْبِقًا ﴿٥٢﴾ وَرَاَ الْمُجْرِمُونَ النَّارَ فَظَنُّٓوا اَنَّهُمْ مُوَاقِعُوهَا
وَلَمْ يَجِدُوا عَنْهَا مَصْرِفًا ۟ ﴿٥٣﴾ وَلَقَدْ صَرَّفْنَا فِي هٰذَا الْقُرْاٰنِ لِلنَّاسِ مِنْ كُلِّ مَثَلٍ وَكَانَ الْاِنْسَانُ اَكْثَرَ
شَيْءٍ جَدَلًا ﴿٥٤﴾ وَمَا مَنَعَ النَّاسَ اَنْ يُؤْمِنُٓوا اِذْ جَٓاءَهُمُ الْهُدٰى وَيَسْتَغْفِرُوا رَبَّهُمْ

---

*şeytanı (bir nəfsi) var.” Soruşdular ki, “ey peyğəmbər, sənin də şeytanın var?” Buyurdu: “Bəli, amma mənim şeytanım mənə itaət edibdir.” (Əhməd bin Hənbəl, Müsnəd, VI/115) Belə doğru sözü qoyub yalan, boş-boş sözləri özlərinə şüar ediblər. Bunlardan başqa, da çox sözlər deyiblər. Onları yazmaqla vaxtım zay olduğundan bundan vaz keçdim).*

(Onlardan sizə bir fayda olmaz). (وَهُمْ لَكُمْ عَدُوٌّ بِئْسَ لِلظَّالِمِينَ بَدَلًا) – (şeytanın özü və övladları) **sizin düşməninizdir. Zalımlar üçün nə pis əvəzdir** (dəyişiklikdir, Allah-Təalanın əvəzinə şeytana itaət edirlər).

**51)** (مَٓا اَشْهَدْتُهُمْ خَلْقَ السَّمٰوَاتِ وَالْاَرْضِ) - **mən** (şeytanın özünü və övladlarını sizin dediyiniz kimi) **səmaların və yerin yaradılmasında şahid etməmişəm** (ki, siz onları dost tutub mənə şərik qoşursunuz). (وَلَا خَلْقَ اَنْفُسِهِمْ) – **nə də öz yaradılışlarına** (şahid etməmişəm (ki, bu səbəbdən mənə şərik olsunlar). (وَمَا كُنْتُ مُتَّخِذَ الْمُضِلِّينَ عَضُدًا) - **mən** (xalqı) **zəlalətə salan şəxsləri özümə köməkçi edən də deyiləm.**

**52)** (وَيَوْمَ يَقُولُ نَادُوا شُرَكَٓاءِيَ الَّذِينَ زَعَمْتُمْ) – (qiyamət) **günü** (Allah-Təala müşriklərə) **deyər:** (ey müşriklər, mənə ortaq olduğunu) **iddia etdiyiniz şəriklərimi çağırın** (ki, gəlib sizə kömək olsunlar). (فَدَعَوْهُمْ فَلَمْ يَسْتَجِيبُوا لَهُمْ) – (müşriklər də o şərikləri) **çağırarlar,** (şəriklər) **onlara cavab verməyib** (onlara kömək etməzlər). (وَجَعَلْنَا بَيْنَهُمْ مَوْبِقًا) – (bu sözdən sonra müşriklərin) **arasına** (cəhənnəm çöllərindən) **bir çöl qoyub,** (hamısı da orada əzaba düçar olarlar).

**53)** (وَرَاَ الْمُجْرِمُونَ النَّارَ فَظَنُّٓوا اَنَّهُمْ مُوَاقِعُوهَا) - **günahkar** (və kafirlər) **cəhənnəm odunu gördükdə,** (öz əməllərinə baxıb razı olmasalar da) **mütləq ora girəcəklərini yəqin edərlər.** (وَلَمْ يَجِدُوا عَنْهَا مَصْرِفًا) – **oradan** (əzabdan) **qaçmağa bir yer də tapa bilməzlər** (ki, nicat tapsınlar. Həmişə əzab içində olacaqlar).

**54)** (وَلَقَدْ صَرَّفْنَا فِي هٰذَا الْقُرْاٰنِ لِلنَّاسِ مِنْ كُلِّ مَثَلٍ) - **həqiqətən, bu Quranda insanlar üçün hər cür məsəli bəyan etdik** (ki, fikir verib, haqqı dərk edib batildən kənar olsunlar). (وَكَانَ الْاِنْسَانُ اَكْثَرَ شَيْءٍ جَدَلًا) - **insan isə** (məxluqların içində) **hər kəsdən çox mübahisə edib** (haqdan qaçandır).

**55)** (وَمَا مَنَعَ النَّاسَ اَنْ يُؤْمِنُٓوا اِذْ جَٓاءَهُمُ الْهُدٰى وَيَسْتَغْفِرُوا رَبَّهُمْ) - **insanlara** (Allah-Təala tərəfindən) **hidayət edən** (bir peyğəmbər) **gəldikdə, onların** (Allah-Təalaya)

اِلَّآ اَنْ تَأْتِيَهُمْ سُنَّةُ الْاَوَّلِينَ اَوْ يَأْتِيَهُمُ الْعَذَابُ قُبُلًا ﴿٥٥﴾ وَمَا نُرْسِلُ الْمُرْسَلِينَ اِلَّا مُبَشِّرِينَ وَمُنْذِرِينَۚ وَيُجَادِلُ الَّذِينَ كَفَرُوا بِالْبَاطِلِ لِيُدْحِضُوا بِهِ الْحَقَّ وَاتَّخَذُوٓا اٰيَاتِي وَمَٓا اُنْذِرُوا هُزُوًا ﴿٥٦﴾ وَمَنْ اَظْلَمُ مِمَّنْ ذُكِّرَ بِاٰيَاتِ رَبِّهِ فَاَعْرَضَ عَنْهَا وَنَسِيَ مَا قَدَّمَتْ يَدَاهُۜ اِنَّا جَعَلْنَا عَلٰى قُلُوبِهِمْ اَكِنَّةً اَنْ يَفْقَهُوهُ وَفِٓي اٰذَانِهِمْ وَقْرًاۜ وَاِنْ تَدْعُهُمْ اِلَى الْهُدٰى فَلَنْ يَهْتَدُوٓا اِذًا اَبَدًا ﴿٥٧﴾ وَرَبُّكَ الْغَفُورُ ذُو الرَّحْمَةِۜ لَوْ يُؤَاخِذُهُمْ بِمَا كَسَبُوا لَعَجَّلَ لَهُمُ الْعَذَابَۜ بَلْ لَهُمْ مَوْعِدٌ لَنْ يَجِدُوا مِنْ دُونِهِ مَوْئِلًا ﴿٥٨﴾

---

**iman gətirib bağışlanma diləmələrinə mane olmadı,** (اِلَّا اَنْ تَأْتِيَهُمْ سُنَّةُ الْاَوَّلِينَ (اَوْ يَأْتِيَهُمُ الْعَذَابُ قُبُلًا – **ancaq** (Allah-Təala tərəfindən iman gətirməyən) **əvvəlki** (ümmətlərin) **başına** (bəla) **gəlməsi kimi onların da başına** (bəla) **gəlməsini gözlədilər,** (necə ki onlara əzab göndərib, bunlara da əzab göndərsin)**, ya da** (qiyamət günündə axirət) **əzabının onlara gəlib çatmasını** (gözlədilər)**.** (İman gətirməyənlər bu iki əzabın hansını gözləyirlər? Dünya əzabını, yoxsa axirət əzabını?)

**56)** (وَمَا نُرْسِلُ الْمُرْسَلِينَ اِلَّا مُبَشِّرِينَ وَمُنْذِرِينَ) - (ey Məhəmməd)**, biz peyğəmbərləri ancaq** (itaət edənləri axirət savabı ilə) **müjdələyən və** (günahkarları axirət əzabı ilə) **qorxudan olaraq göndərdik,** (necə ki səni göndərdik)**.** (وَيُجَادِلُ الَّذِينَ كَفَرُوا بِالْبَاطِلِ لِيُدْحِضُوا بِهِ الْحَقَّ) **- lakin kafir şəxslər batil sözləriylə** (bizim tərəfimizdən gələn peyğəmbərlərə qarşı çıxıb mübahisə edirlər ki,) **haqqı batil etsinlər.** (Gah deyirlər: insandan peyğəmbər olmaz, gah deyirlər: insandan peyğəmbər olsa da, bizim böyük, zəngin şəxslərdən gərək olsun)**.** (وَاتَّخَذُوا اٰيَاتِي وَمَٓا اُنْذِرُوا هُزُوًا) **– mənim ayələrimə və** (peyğəmbərlər tərəfindən) **qorxuduldudqları əzablara istehza etdilər.**

**57)** (وَمَنْ اَظْلَمُ مِمَّنْ ذُكِّرَ بِاٰيَاتِ رَبِّهِ فَاَعْرَضَ عَنْهَا وَنَسِيَ مَا قَدَّمَتْ يَدَاهُ) **- Allah-Təalanın ayələri** (Quran) **onlara oxunarkən ondan üz döndərib,** (iman gətirməyən) **və öz əlləri ilə edib** (qabaqcadan göndərdikləri günah əməllərin aqibətini, cəzasını) **unudan şəxsdən daha zalım olan kimdir?** (اِنَّا جَعَلْنَا عَلٰى قُلُوبِهِمْ اَكِنَّةً اَنْ يَفْقَهُوهُ) **- həqiqətən,** (ey Məhəmməd, biz belə şəxslərin küfrləri səbəbinə) **onların qəlblərinə pərdələr çəkdik** (ki, Qurandan heç bir şey anlamasınlar)**.** (وَفِي اٰذَانِهِمْ وَقْرًا) **- və qulaqlarına da karlıq verdik** (ki, haqq sözü eşitməsinlər)**.** (وَاِنْ تَدْعُهُمْ اِلَى الْهُدٰى فَلَنْ يَهْتَدُوا اِذًا اَبَدًا) - (ey Məhəmməd)**, əgər sən onları hidayətə çağırsan da, əlbəttə onlar heç vaxt hidayəti qəbul etməyib,** (imana daxil olan deyillər)**.**

**58)** (وَرَبُّكَ الْغَفُورُ ذُو الرَّحْمَةِ) - (ey Məhəmməd)**, sənin rəbbin Allah-Təala çox bağışlayan və rəhmət sahibidir,** (لَوْ يُؤَاخِذُهُمْ بِمَا كَسَبُوا لَعَجَّلَ لَهُمُ الْعَذَابَ) - (ey Məhəmməd, əgər Allah-Təala bu Məkkə əhlini) **etdiklərinə görə cəzalandırsaydı, əlbəttə, tezliklə onlara əzab göndərərdi.** (Amma Allah-Təala öz lütf və rəhmətindən onların əzabını təxirə salıbdır)**.** (بَلْ لَهُمْ مَوْعِدٌ لَنْ يَجِدُوا مِنْ دُونِهِ مَوْئِلًا)

وَتِلْكَ الْقُرٰىٓ اَهْلَكْنَاهُمْ لَمَّا ظَلَمُوا وَجَعَلْنَا لِمَهْلِكِهِمْ مَوْعِدًا ﴿٥٩﴾

---

**- lakin onlara** (əzabdan ötrü) **vəd edilən bir zaman** (qiyamət günü) **var ki, o gün** (Allah-Təaladan) **başqa qurtula biləcəkləri bir sığınacaq tapa bilməzlər.**

**59)** (وَتِلْكَ الْقُرٰى اَهْلَكْنَاهُمْ لَمَّا ظَلَمُوا) – (baxın, ey Məkkə əhli)**, bunlar** (sizdən əvvəlki nəsillərdir - Ad, Səmud, Lut, Şüeyb camaatlarıdır)**, zülm etdikdə onları həlak etdik.** (وَجَعَلْنَا لِمَهْلِكِهِمْ مَوْعِدًا) **- həlak olmaları üçün müəyyən bir vaxt qoyduq.** (O vaxt da hamısını həlak etdik. Əgər Allah-Təala siz Məkkə əhlini də cəzalandırmaq istəsə, əzab göndərər. Amma əzabınızı təyin edilmiş olan qiyamət gününə qədər təxirə salıbdır. Musa (ə.s), Allah-Təaladan soruşdu: "İlahi, bəndələrindən hansı birini daha çox sevirsən?" Allah-Təala buyurdu: "O şəxs ki məni zikr edib unutmur." Musa dedi: "İlahi, sənin bəndələrindən sənə tabe olub hökmlərinə əməl edən kimdir?" Allah-Təala buyurdu: "O şəxsdir ki, haqq sözü deyib ədalətlə hökm edər və nəfsinə tabe olmaz." Musa dedi: "İlahi, sənin bəndələrindən ən çox alim olan kimdir?" Allah-Təala buyurdu: "O şəxsdir ki, bir kəlmə öyrənmək üçün həmişə elm dalınca gəzər." Musa dedi: "İlahi, bəndələrindən alim olan bir şəxsi mənə göstər ki, ondan bir qədər elm öyrənim." Allah-Təala buyurdu: "Səndən daha alim olan şəxs Xızırdır." Musa dedi: "İlahi, mən onu haradan tapa bilərəm?" Xitab gəldi: "İki dənizin (Aralıq dənizi ilə Atlantik okeanının)* bir-birinə qarışdığı yerdə bir daşın yanında onu taparsan." Xitab gəldi: "Balığı harda unutsanız, Xızır orda olacaqdır." Musa səfər tədarükü görüb öz qulamını da götürüb yola düşdü. Necə ki Allah-Təala bundan sonrakı ayələrdə xəbər verir. Bu ayələrdə Musa ilə Xızırın əhvalatını qeyd etməkdən məqsəd elmin şərəfini bəyan etməkdir. Musa kimi Kəlimullah (Allahla danışan) bir şəxs çölləri, biyabanları gəzir ki, bir kəlmə də olsa, elm öyrənsin. Qurani-Şərifin qissələrinin ehtiva etdiyi dərin mənalardan, gərək, qafil olmayaq. Bəzi təfsirçilər Musa ibn İmran uca bir peyğəmbər olduğundan bu qissə sahibinin o deyil, Hz. Yusifin nəslindən olub peyğəmbərliyi məlum olmayan Musa ibn Mişa olduğunu iddia ediblər. Amma Allah-Təalanın Yusif surəsində dediyi: "Hər bir elm sahibindən daha yaxşı bilən biri var", -ayəsindən qafil olublar)**.**

*(*Qeyd:* *Bu iki dənizin bir-birinə qarışdığı yer dar bir boğazdır. Bir tərəfi İspaniya, bir tərəfi Fas (Mərakeş) məmləkətidir. Əməvi xəlifələrindən Vəlid ibn Əbdülməlik tərəfindən Afrikaya hakim təyin edilən Musa ibn Nuseyr Ləhmiyə İspaniya (Əndəlüs) məmləkətini fəth etmə fərmanı gələndə Musa ibn Nuseyr öz bərbəri qulamı Tariq ibn Ziyadı 12 min əsgərlə İspaniyanı fəth etməyə göndərdi. 12 min əsgərin hamısı bərbəri olub, aralarında ancaq onlara Quran və şəriət ehkamını öyrətmək üçün 12 nəfər ərəb var idi. Tariq ibn Ziyad ordusu ilə Mərakeşə daxil olub, həmin dar boğazdan gəmilərlə keçib İspaniyaya daxil olandan sonra o boğazın yaxınlığındakı dağı aşaraq İspaniyanı fəth etdiyindən o dağın adı bütün dillərdə Cəbəlüt-tariq, yəni Tariq dağı*

**وَاِذْ قَالَ مُوسٰى لِفَتٰيهُ لَٓا اَبْرَحُ حَتّٰٓى اَبْلُغَ مَجْمَعَ الْبَحْرَيْنِ اَوْ اَمْضِيَ حُقُبًا ﴿٦٠﴾ فَلَمَّا بَلَغَا مَجْمَعَ بَيْنِهِمَا نَسِيَا حُوتَهُمَا فَاتَّخَذَ سَبِيلَهُ فِي الْبَحْرِ سَرَبًا ﴿٦١﴾ فَلَمَّا جَاوَزَا قَالَ لِفَتٰيهُ اٰتِنَا غَدَٓاءَنَاۘ لَقَدْ لَقِينَا مِنْ سَفَرِنَا هٰذَا نَصَبًا ﴿٦٢﴾ قَالَ اَرَاَيْتَ اِذْ اَوَيْنَٓا اِلَى الصَّخْرَةِ فَاِنّ۪ي نَس۪يتُ الْحُوتَۘ وَمَٓا اَنْسَانٖيهُ اِلَّا الشَّيْطَانُ اَنْ اَذْكُرَهُۚ وَاتَّخَذَ سَب۪يلَهُ فِي الْبَحْرِۗ عَجَبًا ﴿٦٣﴾**

---

*və o boğaza Tariq boğazı deyildi. Müsəlmanların fəth etdiyi o boğaz indi İngiltərə dövlətinin ixtiyarındadır. Bu yerə çatanda qələmi əldə saxlamağa güc qalmayıb, gözlərimdən damla-damla yaş axdı. Bəli, bugünkü gündə islam ümmətinin gözündən, gərək yaş yerinə qan axsın).*

**60)** (وَاِذْ قَالَ مُوسٰى لِفَتٰيهُ لَٓا اَبْرَحُ حَتّٰٓى اَبْلُغَ مَجْمَعَ الْبَحْرَيْنِ) - (ey Məhəmməd, yadına sal)**, bir zaman Musa qulamına demişdi ki,** (mən elə bir səfərə gedirəm ki,) **iki dənizin** (Aralıq dənizi və Atlantik okeanının) **birləşdiyi yerə çatmayınca geri dönməyəcəyəm,** (اَوْ اَمْضِيَ حُقُبًا) **- ya da əgər 80 il də yol getsəm,** (axırda gərək ora gedib çatam)**.** (Musa əs., elm öyrənməyə son dərəcə həvəsli olduğundan dedi ki, əgər 80 il də gəzməli olsa, gərək, gedib Xızırı tapıb ondan elm öyrənsin. Elmin şərəfinə tamaşa edin. Allah-Təalanın peyğəmbəri Musa ibn İmran elm öyrənmək üçün görün nə qədər səy edir)**.**

**61)** (فَلَمَّا بَلَغَا مَجْمَعَ بَيْنِهِمَا) – (Musa öz qulamıyla iki dənizin) **birləşdiyi yerə çatdıqda,** (نَسِيَا حُوتَهُمَا) – (özləriylə gətirdikləri) **balığa** (diqqət etməyib, bundan bizə nə əlamət olacaq, deyib) **unutdu.** (Təfsirçilər deyiblər: o balıq quru balıq idi. Musa özüylə gətirmişdi. Bəlkə də, ovçudan təzə alınmış balıq idi, hələ diri olduğundan bundan sonra qeyd olunan əlamətlər ondan meydana gəldi)**.** (فَاتَّخَذَ سَبِيلَهُ فِي الْبَحْرِ سَرَبًا) – (Musa yatdı, qulamı isə gördü ki, o balıq hərəkət edib suya düşdü)**. Dənizdə** (kanal kimi bir yer açılıb, ordan) **yol tutub getdi.** (Buxari, Elim, 16, 19, 44; Müslüm, Fəzail 170) (Musanın qulamı buna təəccüb etdi. Musa (ə.s), yuxudan durandan sonra qulamı bu mətləbi Musaya deməyi unudub yola düşdülər)**.**

**62)** (فَلَمَّا جَاوَزَا قَالَ لِفَتٰيهُ اٰتِنَا غَدَٓاءَنَا) **– keçib getdiklərində** (bir qədər sonra yorulub oturdular. Musa) **qulamına dedi: nahar yeməyimizi gətir,** (yeyək)**.** (لَقَدْ لَقِينَا مِنْ سَفَرِنَا هٰذَا نَصَبًا) **- həqiqətən, bu səfərimizdə çox zəhmət çəkib əziyyətə düçar olduq.** (Musa yemək istəyəndə qulamın yadına balıq düşdü)**.**

**63)** (قَالَ اَرَاَيْتَ اِذْ اَوَيْنَٓا اِلَى الصَّخْرَةِ فَاِنّ۪ي نَس۪يتُ الْحُوتَ) – (qulam) **dedi:** (ey Musa)**, de görüm nə oldu? O qayaya sığındıqda** (balıq orada dənizə düşdü)**. Həqiqətən, mən onu unutdum.** (Səbəbi nədir, bilmirəm)**.** (وَمَٓا اَنْسَانٖيهُ اِلَّا الشَّيْطَانُ اَنْ اَذْكُرَهُ) **- belə məlum olur ki, onu xatırlamağı mənə ancaq şeytan unutdurdu.** (Hər bir pis əməl şeytana isnad edilir)**.** (وَاتَّخَذَ سَب۪يلَهُ فِي الْبَحْرِ عَجَبًا) – (balıq) **qəribə bir halda dənizdə yol tutub getdi.**

قَالَ ذٰلِكَ مَا كُنَّا نَبْغِ فَارْتَدَّا عَلٰٓى اٰثَارِهِمَا قَصَصًاۙ ﴿٦٤﴾ فَوَجَدَا عَبْدًا مِنْ عِبَادِنَٓا اٰتَيْنَاهُ رَحْمَةً مِنْ
عِنْدِنَا وَعَلَّمْنَاهُ مِنْ لَدُنَّا عِلْمًا ﴿٦٥﴾ قَالَ لَهُ مُوسٰى هَلْ اَتَّبِعُكَ عَلٰٓى اَنْ تُعَلِّمَنِ مِمَّا عُلِّمْتَ رُشْدًا
﴿٦٦﴾ قَالَ اِنَّكَ لَنْ تَسْتَطِيعَ مَعِيَ صَبْرًا ﴿٦٧﴾ وَكَيْفَ تَصْبِرُ عَلٰى مَا لَمْ تُحِطْ بِهٖ خُبْرًا ﴿٦٨﴾ قَالَ
سَتَجِدُنٖٓي اِنْ شَٓاءَ اللّٰهُ صَابِرًا وَلَٓا اَعْصٖي لَكَ اَمْرًا ﴿٦٩﴾ قَالَ فَاِنِ اتَّبَعْتَنٖي فَلَا تَسْـَٔلْنٖي عَنْ شَيْءٍ
حَتّٰٓى اُحْدِثَ لَكَ مِنْهُ ذِكْرًا ﴿٧٠﴾ فَانْطَلَقَا حَتّٰٓى اِذَا رَكِبَا فِي السَّفٖينَةِ خَرَقَهَاۜ قَالَ اَخَرَقْتَهَا لِتُغْرِقَ
اَهْلَهَاۚ لَقَدْ جِئْتَ شَيْـًٔا اِمْرًا ﴿٧١﴾

---

**64)** (قَالَ ذٰلِكَ مَا كُنَّا نَبْغِ) – (Musa) **dedi: "Bu bizim axtardığımız** (və Allah-Təalanın mənə vəd etdiyidir)**."** (فَارْتَدَّا عَلٰٓى اٰثَارِهِمَا قَصَصًا) – (gəldikləri) **izlə dərhal** (balığın suya düşdüyü yerə) **qayıtdılar.**

**65)** (فَوَجَدَا عَبْدًا مِنْ عِبَادِنَٓا) **- ondan sonra axtarıb** (böyük bir daşın yanında) **bəndələrimizdən olan** (Xızırı) **tapdılar.** (اٰتَيْنَاهُ رَحْمَةً مِنْ عِنْدِنَا)**- ona** (Xızıra) **öz dərgahımızdan peyğəmbərlik vermişdik.** (وَعَلَّمْنَاهُ مِنْ لَدُنَّا عِلْمًا) **- və ona öz tərəfimizdən** (ancaq vəhylə bilinən ilahi) **elm öyrətmişdik.**

**66)** (قَالَ لَهُ مُوسٰى هَلْ اَتَّبِعُكَ عَلٰٓى اَنْ تُعَلِّمَنِ مِمَّا عُلِّمْتَ رُشْدًا) **- Musa** (Xızır ilə söhbət edib onun elm və fəzilətinə agah olandan sonra) **dedi:** (Allah-Təalanın) **doğruluq** (və hidayət üçün) **sənə öyrətdiyi elmlərdən mənə də öyrətmən üçün sənə tabe olummu?**

**67)** (قَالَ اِنَّكَ لَنْ تَسْتَطِيعَ مَعِيَ صَبْرًا) - (Xızır) **dedi: "Həqiqətən, sən mənimlə bir yerdə olmağa heç vaxt səbir edə bilməzsən.**

**68)** (وَكَيْفَ تَصْبِرُ عَلٰى مَا لَمْ تُحِطْ بِهٖ خُبْرًا) **- və** (mənim etdiyim, mənasını) **anlamadığın şeylərə necə səbir edə bilərsən?"**

**69)** (قَالَ سَتَجِدُنٖٓي اِنْ شَٓاءَ اللّٰهُ صَابِرًا وَلَٓا اَعْصٖي لَكَ اَمْرًا) – (Musa) **dedi: "İnşallah,** (hər bir işdə) **səbirli olduğumu görərsən və heç bir işdə sənə asi olmaram."**

**70)** (قَالَ فَاِنِ اتَّبَعْتَنٖي) **-** (Xızır) **dedi: "Mənə tabe olmaq istəsən,** (onun şərti var)**.** (فَلَا تَسْـَٔلْنٖي عَنْ شَيْءٍ حَتّٰٓى اُحْدِثَ لَكَ مِنْهُ ذِكْرًا) – (o şərt budur: məndən nə görsən, onun həqiqətini) **sənə bəyan edənə qədər məndən heç nə soruşma."**

**71)** (فَانْطَلَقَا حَتّٰٓى اِذَا رَكِبَا فِي السَّفٖينَةِ) – (Musa şərti qəbul etdi. Xızır Musaya dedi: gəl gedək)**, yola düşüb** (dəniz sahilindəki) **gəmiyə mindikdə,** (خَرَقَهَا) **-** (Xızır gəmidəkilərdən xəbərsiz gəmini) **deşib,** (bir parçasını qopartdı. Musa bunu görən kimi qəzəblənib səbir edə bilmədi)**.** (قَالَ اَخَرَقْتَهَا لِتُغْرِقَ اَهْلَهَا) **-** (Xızıra) **dedi:** (nə edirsən? Gəmini) **deşdin ki, camaatı qərq edəsən?** (لَقَدْ جِئْتَ شَيْـًٔا اِمْرًا) **- həqiqətən,** (günahı) **böyük bir iş** (xəyanət) **etdin.** (Ondan sonra Musa paltarlarını toplayıb gəminin deşiyinə basdı)**.**

قَالَ اَلَمْ اَقُلْ اِنَّكَ لَنْ تَسْتَطِيعَ مَعِيَ صَبْرًا ﴿٧٢﴾ قَالَ لَا تُؤَاخِذْنِي بِمَا نَسِيتُ وَلَا تُرْهِقْنِي مِنْ اَمْرِي عُسْرًا ﴿٧٣﴾ فَانْطَلَقَا حَتّٰى اِذَا لَقِيَا غُلَامًا فَقَتَلَهُ قَالَ اَقَتَلْتَ نَفْسًا زَكِيَّةً بِغَيْرِ نَفْسٍ لَقَدْ جِئْتَ شَيْـًٔا نُكْرًا ﴿٧٤﴾ قَالَ اَلَمْ اَقُلْ لَكَ اِنَّكَ لَنْ تَسْتَطِيعَ مَعِيَ صَبْرًا ﴿٧٥﴾ قَالَ اِنْ سَاَلْتُكَ عَنْ شَيْءٍ بَعْدَهَا فَلَا تُصَاحِبْنِي قَدْ بَلَغْتَ مِنْ لَدُنِّي عُذْرًا ﴿٧٦﴾ فَانْطَلَقَا حَتّٰى اِذَا اَتَيَا اَهْلَ قَرْيَةٍ اسْتَطْعَمَا اَهْلَهَا فَاَبَوْا اَنْ يُضَيِّفُوهُمَا فَوَجَدَا فِيهَا جِدَارًا يُرِيدُ اَنْ يَنْقَضَّ فَاَقَامَهُ قَالَ لَوْ شِئْتَ لَتَّخَذْتَ عَلَيْهِ اَجْرًا ﴿٧٧﴾

---

**72)** (قَالَ اَلَمْ اَقُلْ اِنَّكَ لَنْ تَسْتَطِيعَ مَعِيَ صَبْرًا) - (Xızır) **dedi: "Mən sənə demədim ki, həqiqətən, səndə o qüdrət yoxdur ki, mənimlə** (bir yerdə olub etdiyim işlərə) **səbir edib** (etiraz etməyəsən?)"

**73)** (قَالَ لَا تُؤَاخِذْنِي بِمَا نَسِيتُ) - (Xızır bu sözü deyəndə qeyd olunan şərt Musanın yadına düşüb) **dedi: "Unutduğum şeyə** (şərtə) **görə məni qınama.** (وَلَا تُرْهِقْنِي مِنْ اَمْرِي عُسْرًا) – (sənə tabe olma) **işimdə mənə çətinlik çıxartma.** (Şərti unutduğuma görə, günahımdan keçib sənə tabe olmağı mənə asan et. Xızır Musanın üzrxahlığını qəbul edib onu bağışladı)**.**

**74)** (فَانْطَلَقَا حَتّٰى اِذَا لَقِيَا غُلَامًا فَقَتَلَهُ) – (ondan sonra gəmidən çıxıb) **yola düşdülər ki, bir oğlan uşağı ilə rastlaşdıqda,** (Xızır onu tutub) **öldürdü.** (قَالَ اَقَتَلْتَ نَفْسًا زَكِيَّةً بِغَيْرِ نَفْسٍ) – (Musa Xızırın bu əməlini görəndə dözə bilməyib) **dedi:** (nə qəbih iş gördün?) **"Birinə qarşılıq olmadan pak** (günahsız) **bir şəxsi öldürdün?** (لَقَدْ جِئْتَ شَيْـًٔا نُكْرًا) **- həqiqətən, sən çox çirkin bir iş etdin."**

**75)** (قَالَ اَلَمْ اَقُلْ لَكَ اِنَّكَ لَنْ تَسْتَطِيعَ مَعِيَ صَبْرًا) - (Xızır) **dedi: "Mən sənə demədim ki, həqiqətən, səndə o qüdrət yoxdur ki, mənimlə** (bir yerdə olub etdiyim işlərə) **səbir edib** (etiraz etməyəsən?)

**76)** (قَالَ اِنْ سَاَلْتُكَ عَنْ شَيْءٍ بَعْدَهَا فَلَا تُصَاحِبْنِي) – (Musa) **dedi:** (bağışla, yenə o şərti unutdum)**, bundan sonra əgər yenə səndən bir şey soruşsam, bir daha mənimlə yoldaşlıq etmə.** (قَدْ بَلَغْتَ مِنْ لَدُنِّي عُذْرًا) **- həqiqətən, sən artıq mənim tərəfimdən üzrxahlıq məqamına çatdın,** (məni bağışlamasan da, haqlısan. Xızır onu bağışlayıb günahından keçdi)**.**

**77)** (فَانْطَلَقَا حَتّٰى اِذَا اَتَيَا اَهْلَ قَرْيَةٍ اسْتَطْعَمَا اَهْلَهَا) – (oradan) **çıxıb getdilər, bir kəndə çatdıqda oranın əhalisindən yemək istədilər,** (فَاَبَوْا اَنْ يُضَيِّفُوهُمَا) – (əhali də onlara yemək verib) **qonaq saxlamaqdan imtina etdilər.** (Onlar ac qalıb kənddən kənara çıxdılar)**.** (فَوَجَدَا فِيهَا جِدَارًا يُرِيدُ اَنْ يَنْقَضَّ) – (kəndin kənarında) **yıxılmaq üzrə olan bir divar gördülər,** (فَاَقَامَهُ) – (Xızır o divarı) **yenidən düzəltdi.** (Musa ac ola-ola fəhləlik edib, divarın təmirilə məşğul olduğundan daha dözə bilmədi)**,** (قَالَ لَوْ شِئْتَ لَتَّخَذْتَ عَلَيْهِ اَجْرًا) **- dedi:** (nə edirsən? Kəndin əhalisi bizə yemək vermədiyi bir halda, sən onların divarını təmir edirsən)**. Əgər istəsəydin, bunun üçün mükafat alardın.** (Aclığımızı da dəf edərdik)**.**

قَالَ هٰذَا فِرَاقُ بَيْنِي وَبَيْنِكَۚ سَاُنَبِّئُكَ بِتَأْوِيلِ مَا لَمْ تَسْتَطِعْ عَلَيْهِ صَبْرًا ﴿٧٨﴾ اَمَّا السَّفٖينَةُ فَكَانَتْ
لِمَسَاكٖينَ يَعْمَلُونَ فِي الْبَحْرِ فَاَرَدْتُ اَنْ اَعٖيبَهَا وَكَانَ وَرَٓاءَهُمْ مَلِكٌ يَأْخُذُ كُلَّ سَفٖينَةٍ غَصْبًا ﴿٧٩﴾
وَاَمَّا الْغُلَامُ فَكَانَ اَبَوَاهُ مُؤْمِنَيْنِ فَخَشٖينَٓا اَنْ يُرْهِقَهُمَا طُغْيَانًا وَكُفْرًاۚ ﴿٨٠﴾ فَاَرَدْنَٓا اَنْ يُبْدِلَهُمَا رَبُّهُمَا
خَيْرًا مِنْهُ زَكٰوةً وَاَقْرَبَ رُحْمًا ﴿٨١﴾ وَاَمَّا الْجِدَارُ فَكَانَ لِغُلَامَيْنِ يَتٖيمَيْنِ فِي الْمَدٖينَةِ وَكَانَ تَحْتَهُ
كَنْزٌ لَهُمَا وَكَانَ اَبُوهُمَا صَالِحًاۚ فَاَرَادَ رَبُّكَ اَنْ يَبْلُغَٓا اَشُدَّهُمَا وَيَسْتَخْرِجَا كَنْزَهُمَاۗ رَحْمَةً مِنْ رَبِّكَۚ

---

**78)** (قَالَ هٰذَا فِرَاقُ بَيْنِي وَبَيْنِكَ) – (Xızır) **dedi:** (sənin öz sözünə görə)**, indi mənimlə sənin aranda ayrılıq zamanıdır.** (سَاُنَبِّئُكَ بِتَأْوِيلِ مَا لَمْ تَسْتَطِعْ عَلَيْهِ صَبْرًا) **-** (Musa gördü ki, Xızır ondan ayrılır. Xahiş etdi ki, heç olmasa, bu əməllərini mənə izah et. Hz. Peyğəmbər buyurubdur: “Allah-Təala bizə və qardaşım Musaya rəhmət etsin, əgər səbir edib dözsəydi, çox təəccüblü şeylər görərdi. (Əbu Davud, Huruf, 16) Xızır) **dedi: “Dözə bilmədiyin şeylərin yozumunu** (həqiqətini) **tezliklə sənə xəbər verəcəyəm.”**

**79)** (اَمَّا السَّفٖينَةُ فَكَانَتْ لِمَسَاكٖينَ يَعْمَلُونَ فِي الْبَحْرِ) – (o deşdiyim) **gəmi dənizdə işləyib** (dolanan) **miskin şəxslərin idi,** (10 nəfər qardaş o gəmiyə şərik idi, beşi işləyib, o biri beş nəfərə də baxırdılar)**.** (فَاَرَدْتُ اَنْ اَعٖيبَهَا) – (o gəmini deşməklə) **istədim ki, onu qüsurlu edəm,** (وَكَانَ وَرَٓاءَهُمْ مَلِكٌ يَأْخُذُ كُلَّ سَفٖينَةٍ غَصْبًا) – (çünki) **onların qabaqlarında** (aralarında) **hər bir gəmini qəsb edib** (sahibindən alan) **bir padşah var idi.** (Mən o gəmini qüsurlu etdim ki, gəminin nasaz olduğunu görən padşah onu qəsb etməsin. Gəmini deşməmin sirri budur)**.**

**80)** (وَاَمَّا الْغُلَامُ فَكَانَ اَبَوَاهُ مُؤْمِنَيْنِ) – (öldürdüyüm) **oğlana gəldikdə, onun ata-anası mömin şəxslər idilər.** (فَخَشٖينَٓا اَنْ يُرْهِقَهُمَا طُغْيَانًا وَكُفْرًا) **- biz qorxduq ki,** (əgər o cavan bu dünyada qalsa)**, küfr və tüğyan edib** (ata və anasına da zərər versin, bu səbəbdən Allah-Təalanın əmriylə onu qətlə yetirdim)**.**

**81)** (فَاَرَدْنَٓا اَنْ يُبْدِلَهُمَا رَبُّهُمَا خَيْرًا مِنْهُ زَكٰوةً وَاَقْرَبَ رُحْمًا) – (biz onu qətlə yetirməklə) **Allah-Təalanın** (onun ata-anasına) **ondan da təmiz və** (onlara qarşı mehriban və) **mərhəmətli olan bir övlad bəxş etməsini istədik.** (Təfsirçilər deyiblər ki, Allah-Təala o oğlun əvəzinə onun ata-anasına bir qız bəxş etdi, o qızdan bir peyğəmbər dünyaya gəldi)**.**

**82)** (وَاَمَّا الْجِدَارُ فَكَانَ لِغُلَامَيْنِ يَتٖيمَيْنِ فِي الْمَدٖينَةِ) **- o divara gəldikdə, o şəhərdə olan iki yetim oğlanın idi.** (وَكَانَ تَحْتَهُ كَنْزٌ لَهُمَا) – (o divarın) **altında** (o yetim uşaqların) **xəzinələri var idi.** (وَكَانَ اَبُوهُمَا صَالِحًا) **- onların ataları da saleh bir şəxs idi.** (فَاَرَادَ رَبُّكَ اَنْ يَبْلُغَٓا اَشُدَّهُمَا) – (ey Musa)**, rəbbin Allah-Təala onlar həddi-büluğa çatana qədər** (o xəzinəni onlardan ötrü saxlamaq) **istədi.** (وَيَسْتَخْرِجَا كَنْزَهُمَا رَحْمَةً مِنْ رَبِّكَ) **– ondan sonra rəbbin Allah-Təaladan bir** (lütf və) **rəhmət olaraq xəzinələrini çıxarıb** (ona sahib olmalarını istədi. O səbəbdən mən o

وَمَا فَعَلْتُهُ عَنْ اَمْرِيِّ ذٰلِكَ تَأْوِيلُ مَا لَمْ تَسْطِعْ عَلَيْهِ صَبْرًاۜ ﴿٨٢﴾ وَيَسْـَٔلُونَكَ عَنْ ذِي الْقَرْنَيْنِّ قُلْ
سَاَتْلُوا عَلَيْكُمْ مِنْهُ ذِكْرًاۜ ﴿٨٣﴾ اِنَّا مَكَّنَّا لَهُ فِي الْاَرْضِ وَاٰتَيْنَاهُ مِنْ كُلِّ شَيْءٍ سَبَبًاۙ ﴿٨٤﴾ فَاَتْبَعَ سَبَبًا
﴿٨٥﴾ حَتّٰىٓ اِذَا بَلَغَ مَغْرِبَ الشَّمْسِ

---

divarı təmir etdim ki, o xəzinə yox olmasın). (وَمَا فَعَلْتُهُ عَنْ اَمْرِي) – (ey Musa), **bu əməllərin heç birini özümdən** (öz rəy və ictihadımla) **etməmişəm,** (Allah-Təalanın əmri ilə etmişəm). (ذٰلِكَ تَأْوِيلُ مَا لَمْ تَسْطِعْ عَلَيْهِ صَبْرًا) **- səbir edib dözə bilmədiyin şeylərin yozumu budur.** (Ey Musa, indi sən bir tərəfə get, mən başqa bir tərəfə gedim. Səbirli olmaq çox böyük, uca bir xüsusiyyətdir. Musa ibn İmran Allah-Təalanın din və ehkamını qorumada son dərəcə təəssübkeş olduğundan Xızırın etdiyi əməllərə dözə bilməyib onun elmindən məhrum qaldı)**.**

**83)** (وَيَسْـَٔلُونَكَ عَنْ ذِي الْقَرْنَيْنِ قُلْ سَاَتْلُوا عَلَيْكُمْ مِنْهُ ذِكْرًا) **-** (ey Məhəmməd, müşriklər) **səndən Zülqərneyn * əhvalatını soruşurlar.** (Onlara) **de ki, onun xəbərini sizə söyləyərəm.**

*(***Qeyd:** Zülqərneyn Filipin oğlu olan Makedonyalı İsgəndərdir. Böyük hökmdarlardan olub, son dərəcə şücaətli olduğundan ərəblər tərəfindən iki buynuzlu qoça bənzədilib Zülqərneyn ləqəbi verilmişdir.Tarix bilgisi olmayan şəxslər Zülqərneyn sözü haqqında elə mənasız sözlər deyiblər ki, heç qeyd etməyə ehtiyac yoxdur. Ərəblərin arasında bundan başqa da Zülqərneyn ləqəbi verilənlər vardır. O cümlədən bəni-Həmdan camaatından olan böyük əmir Vəcihüd-dövlə Zülqərneyn ləqəbi ilə yad olunur. H. 414-cü ildə İskəndəriyyədə Fatimi xəlifələrindən əz-Zahir Biəmrillah tərəfindən vali olub h. 428-ci ildə vəfat edibdir. Həmin Makedoniyalı İsgəndər Allah-Təalanın Qurani-Şərifdə xəbər verdiyi kimi Şərqə və Qərbə sazhib olub Misiri İrandan alıb hökmdarları olan Böyük Daranı da qətlə yetirdi. Misir mülkündə dəniz sahilində İsgəndəriyyə şəhərini tikdirdi. Bir çox şəhərləri, o cümlədən Qafqazın paytaxtı olan Tiflis şəhərini tikən də həmin böyük İsgəndərdir. İsgəndəriyyə şəhərinin planını özü çəkib, şəhərin tikilməsini məşhur mühəndis Navkratisə həvalə etdi. Dünyada az ömür sürsə də, hünəri və şəcaətlə böyük fəthlər etdiyindən böyük məqam sahibi olub, Qurani-Şərifdə yad edilməyə layiq olubdur. 10 il dünyada hökm sürüb, yer üzünün bir çox hissəsinə sahib oldu, e.ə. 332-ci ildə, ya da hicrətdən qabaq 954-cü ildə taxta çıxıb, bir çox ölkələri fəth edəndən sonra e.ə. 323-cü ildə və ya hicrətdən qabaq 933-cü ildə may ayının 24-də Babil şəhərində 34 (33) yaşında vəfat etdi. Nəşini gətirib İsgəndəriyyədə dəfn etdilər. Qüreyş camaatı gedib yəhudilərdən İsgəndərin əhvalatını öyrənib, gəlib Hz. Peyğəmbərdən soruşdular).*

**84)** (اِنَّا مَكَّنَّا لَهُ فِي الْاَرْضِ) **- həqiqətən, biz** (İsgəndərə) **yer üzündə güc və qüvvət verib,** (hər bir şeyi ona asanlaşdırdıq)**.** (وَاٰتَيْنَاهُ مِنْ كُلِّ شَيْءٍ سَبَبًا) **- və** (onun məqsədinə uyğun olaraq) **hər bir şeyin səbəblərini ona bəxş etdik.**

**85-86)** (فَاَتْبَعَ سَبَبًا حَتّٰى اِذَا بَلَغَ مَغْرِبَ الشَّمْسِ) – (insanı məqsədinə çatdıran) **səbəbə tabe olub,** (yəni hakimiyyət və qələbə üçün hər bir vasitəyə sahib

وَجَدَهَا تَغْرُبُ فِي عَيْنٍ حَمِئَةٍ وَوَجَدَ عِنْدَهَا قَوْمًاۜ قُلْنَا يَا ذَا الْقَرْنَيْنِ اِمَّٓا اَنْ تُعَذِّبَ وَاِمَّٓا اَنْ تَتَّخِذَ فِيهِمْ
حُسْنًا ﴿٨٦﴾ قَالَ اَمَّا مَنْ ظَلَمَ فَسَوْفَ نُعَذِّبُهُ ثُمَّ يُرَدُّ اِلٰى رَبِّهِ فَيُعَذِّبُهُ عَذَابًا نُكْرًا ﴿٨٧﴾ وَاَمَّا مَنْ اٰمَنَ
وَعَمِلَ صَالِحًا فَلَهُ جَزَٓاءًۨ الْحُسْنٰىۚ وَسَنَقُولُ لَهُ مِنْ اَمْرِنَا يُسْرًاۜ ﴿٨٨﴾ ثُمَّ اَتْبَعَ سَبَبًا ﴿٨٩﴾ حَتّٰٓى اِذَا
بَلَغَ مَطْلِعَ الشَّمْسِ وَجَدَهَا تَطْلُعُ عَلٰى قَوْمٍ لَمْ نَجْعَلْ لَهُمْ مِنْ دُونِهَا سِتْرًاۙ ﴿٩٠﴾

---

olub, fəthlə məşğul olub) **günəşin batdığı yerə** (Atlantik okeanının sahilinə) **çatdı.** (Necə ki xalq arasında "günəşin batdığı yer" ifadəsi işlənir, Allah-Təala da adət-ənənəyə uyğun danışır. İsgəndər günəşin batdığı yerə çatdıqda (günəş gözdən qeyb olduğundan ona elə gəldi ki, günəş batır), günəşin qürub etməsinə diqqət edib, uzaqdan qara palçıq çeşməyə oxşadığından ona elə gəldi ki, günəş palçıqlı bir çeşmənin içinə batıb) (وَجَدَهَا تَغْرُبُ فِي عَيْنٍ حَمِئَةٍ وَوَجَدَ عِنْدَهَا قَوْمًا) **– onun yanında** (müşrik) **bir camaata rast gəldi.** (قُلْنَا يَا ذَا الْقَرْنَيْنِ اِمَّا اَنْ تُعَذِّبَ) **-** (ey Məhəmməd)**, biz** (Zülqərneynə) **dedik: ey Zülqərneyn,** (onlar bütpərəst olduğundan sənə ixtiyar verdik)**, ya bunlara əzab et,** (وَاِمَّا اَنْ تَتَّخِذَ فِيهِمْ حُسْنًا) **- ya da haqlarında yaxşılığı seçib,** (onları haqqa dəvət et ki, bəlkə iman etsinlər. Bu ayə işarə edir ki, İsgəndər ya peyğəmbər idi, ya da onun ağılla belə hərəkət etməsini Allah-Təala vəhy kimi göstərmişdir)**.**

**87)** (قَالَ اَمَّا مَنْ ظَلَمَ فَسَوْفَ نُعَذِّبُهُ) – (İsgəndər) **dedi:** (ilahi)**, zalım olub** (sənə şərik qoşan şəxslərə) **gərək əzab edib** (qətlə yetirək)**.** (ثُمَّ يُرَدُّ اِلٰى رَبِّهِ فَيُعَذِّبُهُ عَذَابًا نُكْرًا) – (o müşrikləri qətlə yetirəndən) **sonra öz rəbləri Allah-Təalanın tərəfinə qaytarılarlar, Allah-Təala da onlara dəhşətli bir əzab** (yanma əzabı) **edər.**

**88)** (وَاَمَّا مَنْ اٰمَنَ وَعَمِلَ صَالِحًا فَلَهُ جَزَٓاءًۨ الْحُسْنٰى) - (İsgəndər deyir:) **iman gətirib yaxşı əməl edənlərə isə** (axirətdə) **yaxşı, gözəl əcr və savab vardır.** (وَسَنَقُولُ لَهُ مِنْ اَمْرِنَا يُسْرًا) **- bir də iman gətirən şəxslərə öz tərəfimizdən yaxşı şeylər söyləyib** (onlarla gözəl rəftar edərik)**.**

**89)** (ثُمَّ اَتْبَعَ سَبَبًا) **- ondan sonra** (İsgəndər məğribdən qayıdıb, insanı məqsədinə çatdıran) **səbəbə tabe olub** (məşriqə yönəldi)**.**

**90)** (حَتّٰى اِذَا بَلَغَ مَطْلِعَ الشَّمْسِ) **- ki, günəşin doğduğu yerə** (Şərqi Afrikaya - Sudana) **çatdı.** (وَجَدَهَا تَطْلُعُ عَلٰى قَوْمٍ لَمْ نَجْعَلْ لَهُمْ مِنْ دُونِهَا سِتْرًا) – (İsgəndər o yerə yetişəndə günəşin) **elə bir qövmün üzərində doğduğunu gördü ki, onlardan ötrü** (günəşdən) **başqa bədənlərini örtəcək heç bir örtü yaratmamışdıq.** (İndi də Sudanda, hətta ekvator bölgəsində yaşayan əhalinin əksəriyyəti paltar geymir)**.***

**كَذٰلِكَ وَقَدْ اَحَطْنَا بِمَا لَدَيْهِ خُبْرًا ﴿٩١﴾ ثُمَّ اَتْبَعَ سَبَبًا ﴿٩٢﴾ حَتّٰى اِذَا بَلَغَ بَيْنَ السَّدَّيْنِ**

---

**91)** (كَذٰلِكَ وَقَدْ اَحَطْنَا بِمَا لَدَيْهِ خُبْرًا) – (Zülqərneynin xəbəri belədir, ey Məhəm-məd)**, həqiqətən, biz** (İsgəndərin) **yanında olan hər bir şeyə ətraflı agah olduq.** (Onun əməlləri, qoşunu, savaşları, xəzinələri, bunların heç biri bizim elmimizdən kənar deyildi)**.**

**92-93)** (ثُمَّ اَتْبَعَ سَبَبًا حَتّٰى اِذَا بَلَغَ بَيْنَ السَّدَّيْنِ) **- ondan sonra** (İsgəndər oradan qa-yıdıb, insanı məqsədinə çatdıran) **səbəbə tabe olub,** (şimal tərəfinə yönəlib)**, belə ki, aralarında sədd olan iki yerin ortasına çatdıqda),**

*(*Qeyd: Yer üzündə sakin olan məxluqat üçün ən nurlu, ən çox mənfəət verən, ən böyük ulduz Günəşdir. Bəlkə, ondan da böyük və nurlu ulduzlar var, amma bizdən çox uzaq olduqlarından onların həqiqəti olduğu kimi qəbul edilməyib, onların əzəmət və nurunun bizim üçün elə bir əhəmiyyəti yoxdur. Yerdə məskun olan canlıların yaşaması və bütün bitkilərin, ağacların, mineralların yetişməsi, insanlara fayda verməsi məhz günəş nurunun hərarəti sayəsindədir. Günəşin istilik yaymadığı yerlərdə yaşamaq ya çətindir, necə ki bəzi şimal məmləkətlərində belədir və ya qeyri-mümkündür. Necə ki 90 dərəcə şaxta olan şimal bölgələrində şiddət, soyuq və gecə-gündüzün normal uzunluqda olmadığından o yerlərdə insanların yaşaması mümkün deyildir. Qədim və yeni hər iki astronomlar günəşin ətrafında olan planetlərin də yer kürəsi kimi günəşin nur və hərarətindən istifadə etdiyinə inanıblar. Fərqləri bundadır ki, qədim astronom-lar günəşin gündə bir dəfə yerin ətrafında döndüyünə inanırdılar. Özü də bu hərəkət günəşin özündən qaynaqlanmayıb, "fələki-Atlas" (Atlas fələyi) və "fələki-əflakın" (fələklər fələki: ilahi ərş) dövr etməsilə meydana gəlir. Amma yeni astronomlar günəşin yerin ətrafında dövr etməsini imkansız sayıb, günəş sistemindəki digər planetlərin ol-duğu kimi yer kürəsinin də günəşin və öz oxunun ətrafında dövr etdiyinə inanırlar. Günəş öz oxu ətrafında 25 gün 8 saatda dönər. Məsələn, bir portağalın ortasından bir mil keçirib, o portağalı milin ətrafında hərəkət etdirməklə günəşin də belə hərəkət etdiyini göstəriblər. Günəş ehtiva etdiyi maddələrin şiddətlə parlaması ilə atəşdən dalğaları olan bir dəryaya oxşayır. Hərarəti fövqəladə və təsəvvürdən xaricdir. Onun əzəmətini yerlə müqayisə edəndə yer kürəsi onun qarşısında samanlığın müqabilindəki bir buğda kimidir. Astronomların təxmini hesablamalarına görə, günəşin ölçüsü 1 mil-yon 300 verstdir (1 verst 1,05 km.-dir). Günəş yer kürəsindən 1 milyon 400 min dəfə böyükdür. Yer kürəsinin günəşdən uzaqlığı 140 milyon verstdir. Özlərini alim sayan təfsirçilər belə əzəmətli bir günəş haqqında gör necə mənasız şeylər qeyd ediblər. Ağıl-lı şəxs belə söz deməz. Məsələn, Günəşin qürub etməsi haqqında deyiblər ki, guya o, palçıqlı isti bir çeşmənin içinə qürub edir. Müaviyə Kə`bül-Əxbara dedi: "Tövratda günəşin qürub etməsi necə qeyd olunub?" Kə`b dedi: "Palçıqlı suyun içinə qürub edir." Günəşin doğması haqqında da belə yazıblar: bir şəxs deyir: "Mən Çinə (Xətay) getdim, orada gedib, günəşin doğduğu yeri görüm, elə bir camaatla rastlaşdıq ki, hamısı çılpaq idi. Onların dilinə bələd olan bir yoldaşım var idi. Bizdən soruşdular ki, günəşin doğmasına tamaşa etməyə gəlibsiniz? Dedik ki, bəli. Dedilər: "Səbir edin, səhər olsun." Səhər oldu, durub günəşin suyun içindən doğmasını gözlədik. Şiddətli*

وَجَدَ مِنْ دُونِهِمَا قَوْمًاۙ لَا يَكَادُونَ يَفْقَهُونَ قَوْلًا ﴿٩٣﴾ قَالُوا يَا ذَا الْقَرْنَيْنِ اِنَّ يَأْجُوجَ وَمَأْجُوجَ
مُفْسِدُونَ فِي الْاَرْضِ فَهَلْ نَجْعَلُ لَكَ خَرْجًا عَلٰى اَنْ تَجْعَلَ بَيْنَنَا وَبَيْنَهُمْ سَدًّا ﴿٩٤﴾ قَالَ مَا مَكَّنّ۪ي
ف۪يهِ رَبّ۪ي خَيْرٌ فَاَع۪ينُون۪ي بِقُوَّةٍ اَجْعَلْ بَيْنَكُمْ وَبَيْنَهُمْ رَدْمًاۙ ﴿٩٥﴾ اٰتُون۪ي زُبَرَ الْحَد۪يدِ حَتّٰى اِذَا سَاوٰى
بَيْنَ الصَّدَفَيْنِ قَالَ انْفُخُواۜ حَتّٰى اِذَا جَعَلَهُ نَارًاۙ قَالَ اٰتُون۪ٓي اُفْرِغْ عَلَيْهِ قِطْرًاۜ ﴿٩٦﴾

---

*bir səs gəldi. Mən o səsdən bayıldım. Huşa gəldikdə, günəşin artıq doğduğunu gördüm, suyun üzərində zeytun yağı kimi durub yavaş-yavaş yuxarı qalxdı. Ondan sonra gedib balıq tutub, gətirib günəşin qabağına qoydular. Balıq bişdi, biz də o balıqdan yedik". Nuş olsun! Belə mənasız sözlərə nə deyək? Biçarələr Çinin harda yerləşdiyini də bilməyib, günəşin buzdan donan dənizdən doğub çıxdığını və yenə suyun içinə qürub etdiyini deyib mənasız sözlər danışırlar. Belə sözlərin hamısı elmsizlikdəndir. Allaha həmd olsun, bu dövrdə elm səbəbinə Çini öz ölkəmiz kimi tanıyırıq).*

(وَجَدَ مِنْ دُونِهِمَا قَوْمًا لَا يَكَادُونَ يَفْقَهُونَ قَوْلًا) – (Babül-əbvab adlanan Dərbənddən keçib iki dağın ortasına çatdıqda), **elə bir camaat gördü ki,** (İsgəndərin bildiyi dillərdən heç birini bilməyib) **az qala bir söz də anlamırdılar.**

**94)** (قَالُوا يَا ذَا الْقَرْنَيْنِ اِنَّ يَأْجُوجَ وَمَأْجُوجَ مُفْسِدُونَ فِي الْاَرْضِ) - (mütərcim vasitəsilə İsgəndər onlarla danışdı.) **Dedilər: "Ey Zülqərneyn, bizdən o tərəfdə bir tayfa var, onlara Yəcuc-Məcuc deyirlər. Yer üzündə fəsad törədib** (bizə zərər verirlər)**.** (فَهَلْ نَجْعَلُ لَكَ خَرْجًا عَلٰى اَنْ تَجْعَلَ بَيْنَنَا وَبَيْنَهُمْ سَدًّا) – **elə olar ki, sənə xərac verək, bizimlə onların arasında bir sədd** (möhkəm divar) **çəkəsən bəlkə, onların şərindən xilas olaq?**

**95)** (قَالَ مَا مَكَّنّ۪ي ف۪يهِ رَبّ۪ي خَيْرٌ) – (İsgəndər onların cavabında) **dedi: "Rəbbim Allah-Təalanın mənə verdiyi** (qüvvət və qüdrət sizin verdiyiniz var-dövlətdən) **yaxşıdır.** (Ona ehtiyacım yoxdur)**.** (فَاَع۪ينُون۪ي بِقُوَّةٍ اَجْعَلْ بَيْنَكُمْ وَبَيْنَهُمْ رَدْمًا) – **öz qüvvənizlə** (işləməklə) **mənə kömək edin ki, sizinlə onların arasında möhkəm bir divar çəkim."** (Heç vaxt onu aşıb sizin tərəfinizə keçə bilməsinlər)**.**

**96)** (اٰتُون۪ي زُبَرَ الْحَد۪يدِ) – (İsgəndər) **dedi: "Mənə** (möhkəm) **dəmir parçaları gətirin"** (ki, burada dəmir lazım olacaqdır. Dəmiri gətirdilər, İsgəndər də səddi tikdirməyə başladı, böyük daşlardan sədd tikib onun arasına dəmir və mis əridib tökdülər)**.** (حَتّٰى اِذَا سَاوٰى بَيْنَ الصَّدَفَيْنِ) – (səddi tikib, sədd qoyulan) **iki dağın arasını da bərabər etdi.** (قَالَ انْفُخُوا حَتّٰى اِذَا جَعَلَهُ نَارًا) – (əmr edib) **dedi ki,** (odun gətirib dəmir etməkdən ötrü ona) **üfləyib** (körükləyin ki, odun yanıb) **od oldu.** (قَالَ اٰتُون۪ٓي اُفْرِغْ عَلَيْهِ قِطْرًا) – (İsgəndər dəmiri əritməyə başlayıb əmr edib) **dedi: "Mis gətirin ki, dəmirin üstünə töküb** (ikisini bir yerdə) **əridim."** (Dəmirlə misi əridib divarın içinə tökdü. Bu şəkildə divarı möhkəmlədib üstündəki səddi* tamamladı)**.**

فَمَا اسْطَاعُوٓا اَنْ يَظْهَرُوهُ وَمَا اسْتَطَاعُوا لَهُ نَقْبًا ﴿٩٧﴾ قَالَ هٰذَا رَحْمَةٌ مِنْ رَبِّيۚ فَاِذَا جَٓاءَ وَعْدُ رَبّ۪ي
جَعَلَهُ دَكَّٓاءَۚ وَكَانَ وَعْدُ رَبّ۪ي حَقًّاۜ ﴿٩٨﴾ وَتَرَكْنَا بَعْضَهُمْ يَوْمَئِذٍ يَمُوجُ ف۪ي بَعْضٍ وَنُفِخَ فِي الصُّورِ
فَجَمَعْنَاهُمْ جَمْعًاۙ ﴿٩٩﴾ وَعَرَضْنَا جَهَنَّمَ يَوْمَئِذٍ لِلْكَافِر۪ينَ عَرْضًاۙ ﴿١٠٠﴾

---

*(*Qeyd: Səddin və Yəcuc-Məcucun həqiqəti barəsində təfsirçilər müxtəlif və mənasız sözlər deyiblər. Onları qeyd etməkdən vaz keçdik. Yəcuc-Məcuc Xəzər tayfasıdır. Xəzər dənizi onların adıyla adlanıb, Babül-əbvab da deyilən Dərbənddən xeyli şimalda məskun olurdular. Fəsadçı, şərir bir tayfa idilər. Ərəblər onlara Yəcuc-Məcuc deyirdilər. Bu iki söz ərəbcələşdirilmişdir. Bu tayfa çox fəsadçı olduğundan camaat İsgəndərdən xahiş etdi ki, onların qabağından bir sədd çəksin. O dövrdə divarı dağıdıb, ya da deşməyə bir alət olmadığından, divar da hündür və hamar olduğundan Yəcuc-Məcuc da divarın üstünə çıxıb bu biri tərəfə keçə bilmədiyinə görə, bir müddət onların şərindən qurtuldular. İsgəndər Dərbənddən bir neçə mil şimalda o səddi tikdirib üzü məğrib tərəfə onu uzatdılar. Amma səddin sonu hara gedib çatır, məlum deyildir. İsgəndərdən sonra İran padşahları o səddi dağılmaqdan qoruyub, Bəhram Gur da onu bərpa etdi. Hz. Peyğəmbərin zamanında İran padşahı olan Xosrov Pərviz o səddi yenidən bərpa etdi. Ondan sonra o səddi qoruyan olmayıb, Xəzər tayfası da qüvvətləndiyindən o səddi dağıdıb sel kimi gəlib dünyaya sahib oldular).*

**97)** (فَمَا اسْطَاعُوا اَنْ يَظْهَرُوهُ) – (sədd uca və hamar olduğundan Yəcuc- Məcuc) **onu aşmağa qadir olmadı,** (وَمَا اسْتَطَاعُوا لَهُ نَقْبًا) **- və** (o sədd möhkəm olduğuna görə də) **onu dəlməyə qadir olmayıb** (səddin o tayındakılar da onların şərindən qurtuldular)**.**

**98)** (قَالَ هٰذَا رَحْمَةٌ مِنْ رَبّ۪ي) – (İsgəndər) **dedi: "Bu** (səddin mənim tərəfimdən tikilməsi) **rəbbim Allah-Təaladan mənə olan bir nemətdir.** (فَاِذَا جَٓاءَ وَعْدُ رَبّ۪ي جَعَلَهُ دَكَّٓاءَ) – (bu səddin dağılması üçün) **rəbbim Allah-Təalanın təyin etdiyi vaxt gəldikdə isə, o səddi dağıdıb yerlə yeksan edər,** (Yəcuc-Məcuc da oradan gələrlər)**.** (وَكَانَ وَعْدُ رَبّ۪ي حَقًّا) **– rəbbim Allah-Təalanın bu vədi haqdır",** (əlbəttə vaqe olacaqdır. İsgəndərin sözü burada bitdi)**.**

**99)** (وَتَرَكْنَا بَعْضَهُمْ يَوْمَئِذٍ يَمُوجُ ف۪ي بَعْضٍ) **–**(ey Məhəmməd, sədd dağılıb Yəcuc-Məcuc oradan çıxdıqları) **gün onları buraxarıq ki, bir-birilərinə qarışıb** (çox olduqlarından dəniz kimi) **dalğalanıb** (dünyaya sahib olarlar. Necə ki oldular)**.** (وَنُفِخَ فِي الصُّورِ فَجَمَعْنَاهُمْ جَمْعًا) – (qiyamət günü) **surətlərə üfürülər,** (bədənlərə ruh daxil olar, ogünkü gün Yəcuc-Məcuc və bütün məxluqatı qüdrətimizə tabe olduqları halda) **bir yerə toplayarıq.**

**100)** (وَعَرَضْنَا جَهَنَّمَ يَوْمَئِذٍ لِلْكَافِر۪ينَ عَرْضًا) **- ogünkü gün cəhənnəmi kafirlərə açıq-aşkar göstərərik,** (hamısı cəhənnəmdəki yerini görər)**.**

اَلَّذِينَ كَانَتْ اَعْيُنُهُمْ فِي غِطَاءٍ عَنْ ذِكْرِي وَكَانُوا لَا يَسْتَطِيعُونَ سَمْعًا ﴿١٠١﴾ اَفَحَسِبَ الَّذِينَ
كَفَرُوا اَنْ يَتَّخِذُوا عِبَادِي مِنْ دُونِي اَوْلِيَاءَ اِنَّا اَعْتَدْنَا جَهَنَّمَ لِلْكَافِرِينَ نُزُلًا ﴿١٠٢﴾ قُلْ هَلْ نُنَبِّئُكُمْ
بِالْاَخْسَرِينَ اَعْمَالًا ﴿١٠٣﴾ اَلَّذِينَ ضَلَّ سَعْيُهُمْ فِي الْحَيٰوةِ الدُّنْيَا وَهُمْ يَحْسَبُونَ اَنَّهُمْ يُحْسِنُونَ
صُنْعًا ﴿١٠٤﴾ اُولٰئِكَ الَّذِينَ كَفَرُوا بِاٰيَاتِ رَبِّهِمْ وَلِقَائِهِ فَحَبِطَتْ اَعْمَالُهُمْ فَلَا نُقِيمُ لَهُمْ يَوْمَ الْقِيٰمَةِ
وَزْنًا ﴿١٠٥﴾

---

**101)** (اَلَّذِينَ كَانَتْ اَعْيُنُهُمْ فِي غِطَاءٍ عَنْ ذِكْرِي) – (kafirlər) **o şəxslərdir ki, gözləri** (mənim tövhidimə işarə edən dəlil və sübutları) **görüb dərk etməkdə qapalı** (pərdədə) **olar** (və məni bilə bilməzlər). (وَكَانُوا لَا يَسْتَطِيعُونَ سَمْعًا) – (dünyada haqqı eşitməkdən özlərini kar edib haqq sözü) **eşitməyə də qüdrətləri olmazdı.**

**102)** (اَفَحَسِبَ الَّذِينَ كَفَرُوا اَنْ يَتَّخِذُوا عِبَادِي مِنْ دُونِي اَوْلِيَاءَ) - (ey Məhəmməd)**, o kafir olan şəxslər elə güman edirlər ki, məni qoyub bəndələrimi özlərinə dost edəcəklər?** (O dostlar da onlara fayda verib onları cəhənnəm odundan xilas edəcək? Onların bu gümanları batildir. O dostlar onlara yardım etməzlər)**.** (اِنَّا اَعْتَدْنَا جَهَنَّمَ لِلْكَافِرِينَ نُزُلًا) - (ey Məhəmməd, necə ki qonaqdan ötrü tədarük görərlər)**, həqiqətən, kafirlərdən ötrü cəhənnəm** (əzabını) **hazırlayıb** (göndərmişik. Qoy gəlib görsünlər)

**103)** (قُلْ هَلْ نُنَبِّئُكُمْ بِالْاَخْسَرِينَ اَعْمَالًا) - (ey Məhəmməd, onlara) **de ki, bəs sizə o şəxsləri xəbər verim ki,** (dünyada xeyir əməl edib onu özlərinə faydalı zənn edirlər? Halbuki) **əməlləri baxımından daha çox zərərə uğrayıb,** (axirətdə əzab görmələrinə bais olacaqdır)**.**

**104)** (اَلَّذِينَ ضَلَّ سَعْيُهُمْ فِي الْحَيٰوةِ الدُّنْيَا) – (onlar) **o şəxslərdir ki, dünya həyatındakı səy və zəhmətləri puç olub** (onlara heç bir mənfəət verməyəcəkdir)**.** (وَهُمْ يَحْسَبُونَ اَنَّهُمْ يُحْسِنُونَ صُنْعًا) **- halbuki onlar elə güman edirlər ki,** (dünyada) **yaxşı və gözəl əməl edib** (axirətdə mükafata çatacaqlar. Abid və zahidlər kimi dünyanı tərk edənlər, əməllərində riya edib camaatın istəyinə uyğun nəsihət edənlər, çürük dünya mənfəəti üçün haqq sözü gizlədib Allah-Təalanın hökmünü dəyişdirib, Qurani-Şərifə müxalif söz danışanların hamısı bu ayənin hökmünə daxildir)**.**

**105)** (اُولٰئِكَ الَّذِينَ كَفَرُوا بِاٰيَاتِ رَبِّهِمْ وَلِقَائِهِ) - (əməlləri boşa gedənlər) **o şəxslərdir ki, öz rəbləri Allah-Təalanın** (tövhidinə işarə edən) **dəlil və sübutları** (qiyamət günündə Allah-Təalanın rəhmət və əzabı ilə) **qarşılaşacaqlarını inkar etdilər.** (فَحَبِطَتْ اَعْمَالُهُمْ) **- onların hər bir xeyir əməlləri puç olub** (onlara heç bir fayda verməyəcəkdir)**.** (فَلَا نُقِيمُ لَهُمْ يَوْمَ الْقِيٰمَةِ وَزْنًا) **- elə şəxslərdən ötrü qiyamət günündə tərəzi qurub** (ehtiram göstərmərik)**.**

ذٰلِكَ جَزَآؤُهُمْ جَهَنَّمُ بِمَا كَفَرُوا وَاتَّخَذُوٓا اٰيَاتِي وَرُسُلِي هُزُوًا ﴿١٠٦﴾ اِنَّ الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا
الصَّالِحَاتِ كَانَتْ لَهُمْ جَنَّاتُ الْفِرْدَوْسِ نُزُلًاۙ ﴿١٠٧﴾ خَالِدِينَ فِيهَا لَا يَبْغُونَ عَنْهَا حِوَلًا ﴿١٠٨﴾
قُلْ لَوْ كَانَ الْبَحْرُ مِدَادًا لِكَلِمَاتِ رَبِّي لَنَفِدَ الْبَحْرُ قَبْلَ اَنْ تَنْفَدَ كَلِمَاتُ رَبِّي وَلَوْ جِئْنَا بِمِثْلِهِ مَدَدًا
﴿١٠٩﴾ قُلْ اِنَّمَآ اَنَا بَشَرٌ مِثْلُكُمْ يُوحٰىٓ اِلَيَّ اَنَّمَآ اِلٰهُكُمْ اِلٰهٌ وَاحِدٌۚ فَمَنْ كَانَ يَرْجُوا لِقَآءَ رَبِّهِ فَلْيَعْمَلْ
عَمَلًا صَالِحًا وَلَا يُشْرِكْ بِعِبَادَةِ رَبِّهٓ اَحَدًا ﴿١١٠﴾

---

**106)** (ذٰلِكَ جَزَآؤُهُمْ جَهَنَّمُ بِمَا كَفَرُوا وَاتَّخَذُوٓا اٰيَاتِي وَرُسُلِي هُزُوًا) - (ey Məhəmməd, məni) **inkar edib** (tövhidimə işarə edən) **dəlil və sübutlarıma, peyğəmbərlərimə istehza etdiklərindən onların cəzasını cəhənnəm** (etdik, həmişə orada əzab içində olacaqlar)**.**

**107)** (اِنَّ الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ) **- həqiqətən, o şəxslər ki,** (Qurana) **iman gətirib yaxşı əməllər edir,** (كَانَتْ لَهُمْ جَنَّاتُ الْفِرْدَوْسِ نُزُلًا) **- onlardan ötrü "firdövs"** (əla cənnət) **bağları hazırlanıbdır.** (Necə ki qonaq gələndə onun üçün mərasim və tədarük görülər. Firdövs bağları da belədir, mömin qonaqlardan ötrü hazırlanıb, onda xəyala gəlməyən şeylər Allah-Təala tərəfindən möminlər üçün hazırlanıbdır)**.**

**108)** (خَالِدِينَ فِيهَا لَا يَبْغُونَ عَنْهَا حِوَلًا) – (firdövs bağlarında) **həmişə qalıb,** (Allah-Təalanın bol nemətinə görə, o bağlardan) **ayrılıb** (başqa məskən istəməzlər)**.**

**109)** (قُلْ لَوْ كَانَ الْبَحْرُ مِدَادًا لِكَلِمَاتِ رَبِّي) - (ey Məhəmməd, müşriklərə) **de ki,** (Allah-Təalanın elmi sonsuzdur)**, əgər dəniz mürəkkəb olsa, onunla rəbbim Allah-Təalanın elmi və hikməti yazılsa,** (لَنَفِدَ الْبَحْرُ قَبْلَ اَنْ تَنْفَدَ كَلِمَاتُ رَبِّي وَلَوْ جِئْنَا بِمِثْلِهِ مَدَدًا) **- əgər** (o dənizə) **bir o qədər də əlavə edib** (Allah-Təalanın elm və hikməti yazılsa)**, rəbbim Allah-Təalanın elm və hikməti bitmədən əvvəl dəniz bitərdi.**

**110)** (قُلْ اِنَّمَا اَنَا بَشَرٌ مِثْلُكُمْ يُوحٰى اِلَيَّ اَنَّمَا اِلٰهُكُمْ اِلٰهٌ وَاحِدٌ) **-** (bu ayədə Allah-Təala öz peyğəmbərinə təvazökarlığı məsləhət görür: "Ey Məhəmməd, peyğəmbər olmağınla qürurlanıb, təkəbbürlənmə. Xalqa) **de ki,** (mənim sizdən heç bir fərqim yoxdur)**, həqiqətən, mən də sizin kimi insanam,** (ancaq fərqimiz bundadır ki,) **məbudunuzun tək və yeganə Allah-Təala olduğu mənə vəhy olunur.** (Bu sözü sizə çatdırmaqla məsulam. (Başqa heç bir fərqimiz yoxdur)**.** (فَمَنْ كَانَ يَرْجُوا لِقَآءَ رَبِّهِ فَلْيَعْمَلْ عَمَلًا صَالِحًا) – (qiyamət günü) **kim, Allah-Təalanın** (rəhmətilə) **qarşılaşıb** (əzabdan xilas olmağa ümid edirsə)**, gərək yaxşı və gözəl əməl etsin** (ki, Allah-Təalanın rəhmətilə qarşılaşsın. Əməl etmədən Allah-Təalanın rəhmətinə ümidvar olmaq əkilməyən yerdə məhsul bitəcəyinə ümid etmək kimidir)**.** (وَلَا يُشْرِكْ بِعِبَادَةِ رَبِّهٓ اَحَدًا) **- və** (əməlini ancaq Allah-Təala üçün edib öz rəbbi Allah-Təalanın ibadətində riya etməsin)**. Heç kimi ona**

**şərik qoşmasın.** (Ancaq belə şəxslər Allah-Təalanın rəhmətinə ümidvar ola bilərlər, nəinki sadəcə saleh əməl edənlər. Əməldə riyakarlıq etmək Allah-Təalaya şirk qoşmaqdır, hər bir ixlaslı əməl gərək ancaq Allah-Təala rizası üçün olsun. Cündüb Züheyr oğlu dedi: "Ey peyğəmbər, mən Allah-Təalanın rizası üçün xeyir əməl edirəm, ancaq camaat bundan xəbərdar olanda sevinirəm." Hz. Peyğəmbər buyurubdur: "Allah-Təala içində şirk olan əməli qəbul etməz." Hz. peyğəmbər buyurubdur: "Kiçik şirkdən çəkinin." Soruşdular: "Ey peyğəmbər, kiçik şirk hansıdır? Buyurdu ki, riyadır")**.**

Allaha həmd olsun, Kəhf surəsinin təfsiri bitdi. Bu mübarək surədə qeyd olunan qissələrdə bəsirət sahiblərindən ötrü böyük ibrət vardır. Diqqətli şəxslər Qurani-Şərifin hər bir qissəsinə və hekayəsinə baxanda, gərək, onun batininə fikir verib, hər bir zəmanəyə uyğun ondan bir məna çıxartsınlar. Hz. Peyğəmbər buyurubdur: "Kəhf surəsini kim oxusa, o surə qiyamət günündə yerdən səmaya kimi onun üçün nur olar. Yatanda bu axırıncı ayəni oxumaq savabdır." (Qazi, Beyzavi, Ənvarut-Tənzil, IV/145)



## MƏRYƏM SURƏSİ

19-cu surədir. Məkkədə nazil olub, 98 ayə, 780 kəlmə, 3700 hərfdir.



بِسْمِ اللهِ الرَّحْمٰنِ الرَّحِيمِ. كٓهٰيٰعٓصٓ ﴿١﴾ ذِكْرُ رَحْمَتِ رَبِّكَ عَبْدَهُ زَكَرِيَّاۚ ﴿٢﴾ اِذْ نَادٰى رَبَّهُ نِدَآءً خَفِيًّا ﴿٣﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1)** (كٓهٰيٰعٓصٓ) **bu mübarək surənin adıdır.**

**2)** (ذِكْرُ رَحْمَتِ رَبِّكَ عَبْدَهُ زَكَرِيَّا) – (sənə oxunan bu surə) **rəbbin Allah-Təalanın öz qulu olan Zəkəriyyaya verdiyi nemətini yada salmaqdan ötrüdür.** (Baxıb görəsiniz ki, Allah-Təala rəhmətini ona necə şamil edibdir)**.**

**3)** (اِذْ نَادٰى رَبَّهُ نِدَآءً خَفِيًّا) **-** (ey Məhəmməd, Zəkəriyyanı yadına sal)**, o zaman ki, dua edib rəbbi Allah-Təalaya* gizlin yalvardı,**

*(*Qeyd:** Hz. Peyğəmbər səfərlərin birində gecə vaxtı yol gedir, səhabə də ucadan "Allahu əkbər" deyirdi. Hz. Peyğəmbər buyurubdur: "Sakit olun, kimi çağırırsınız? Eşidən və görən Allahı çağırırsınızsa, gizlində də çağırsanız, Allah-Təala eşidib agah olandır." Hər bir məqamda, gərək, ədəbə riayət edib, Allah-Təalaya son dərəcə təvazö və qorxu ilə dua, ibadət etmək lazımdır, xüsusən, məscidlərdə ki, ora ibadət məqamıdır. Hətta Quran oxuyanda da məscidlərdə ucadan səs çıxartmaq caiz deyildir. Amma islam ümməti ədəbi Qurani-Şərifdən öyrənmirlər. Alçaq bir hakimin hüzuruna gedəndə ucadan danışıb səs çıxartmağa çəkinirlər, lakin ibadət yeri olan məsciddə hər cür boş əməllər edib Allah-Təalaya bir hakim qədər də diqqət etmirlər. Məsciddə insan hər bir hərəkətində və sükutunda gərək ədəbə riayət edib Allah-Təalanı yaddan çıxartmasın. Vaizlərin camaata xoş olsun deyə məsciddə səs-küy salmaları, ucadan sələvat deməleri məscidin qanununa və ağlın hökmünə zidd şeydir. Xüsusən, məscidlərdə yas saxlayıb, Hz. Hüseynə ağlamaq bəhanəsilə meymunluq edən şəxslər minbərə çıxıb, Allah-Təalanın evində fasiqlər kimi aşiqanə şeirlər və qəzəllər oxuyub o cənabın və pak əhlibeytin ehtiramına xələl gətirilər ki, xalqın içinə çaxnaşma salıb, vaveyla fəryadları altında onlara firdövs cənnətlərini satırlar. Camaat da özünü günahdan pak sayıb, şad və xürrəm olurlar, halbuki bir aləm günahla məsciddən çıxırlar. Bu dərdə heç bir əlac mümkün deyil. Məsciddə etdikləri əməllərin qəbahətini, gərək, dərk etsinlər. Xalqın cahilliyi onları pis günə salıbdır. Onu da dərk etmirlər ki, Hz. Hüseynin qətlini özlərinə sərmayə sayanlardan, gərək, uzaq olub onların sözlərinə etimad etməsinlər. Allah-Təala bizə bəsirət bəxş etsin, bəlkə, eyiblərimizi görüb özümüzü islah edək).*

قَالَ رَبِّ اِنّي وَهَنَ الْعَظْمُ مِنّي وَاشْتَعَلَ الرَّأْسُ شَيْبًا وَلَمْ اَكُنْ بِدُعَآئِكَ رَبِّ شَقِيًّا ﴿٤﴾ وَاِنّي خِفْتُ
الْمَوَالِيَ مِنْ وَرَٓاءٖي وَكَانَتِ امْرَاَتي عَاقِرًا فَهَبْ لي مِنْ لَدُنْكَ وَلِيًّاۙ ﴿٥﴾ يَرِثُني وَيَرِثُ مِنْ اٰلِ
يَعْقُوبَ وَاجْعَلْهُ رَبِّ رَضِيًّا ﴿٦﴾ يَا زَكَرِيَّا اِنَّا نُبَشِّرُكَ بِغُلَامٍ اسْمُهُ يَحْيٰى لَمْ نَجْعَلْ لَهُ مِنْ قَبْلُ سَمِيًّا
﴿٧﴾ قَالَ رَبِّ اَنّٰى يَكُونُ لي غُلَامٌ وَكَانَتِ امْرَاَتي عَاقِرًا وَقَدْ بَلَغْتُ مِنَ الْكِبَرِ عِتِيًّا ﴿٨﴾

---

(Allah-Təala eşidən və görən olduğundan Ona gizli, ya da ucadan dua etməyin eyni olduğuna Zəkəriyya agah olsa da, ədəbə riayət edib Allah-Təalaya gizli dua edib yardım istədi).

**4)** (قَالَ رَبِّ اِنّي وَهَنَ الْعَظْمُ مِنّي) **-** (Zəkəriyya Allah-Təalanı çağırıb) **dedi: "Ey mənim rəbbim, həqiqətən,** (bədənim)**, sümüklərim zəifləyib** (qocaldım)**.** (وَاشْتَعَلَ الرَّأْسُ شَيْبًا) – (qocalıqdan) **başım da od şöləsi kimi şölələnib** (ağardı)**.** (وَلَمْ اَكُنْ بِدُعَآئِكَ رَبِّ شَقِيًّا) **- ey mənim rəbbim,** (həmişə duamı qəbul etmənə öyrənmişəm)**, sənə dua etməklə heç vaxt bədbəxt olmamışam.** (Necə ki bundan əvvəl həmişə mənim dualarımı qəbul edibsən. İndi də dualarımı qəbul et)**.**

**5-6)** (وَاِنّي خِفْتُ الْمَوَالِيَ مِنْ وَرَٓاءٖي) **- ey mənim rəbbim, həqiqətən məndən sonra qalan** (qardaşlarım və əmim oğullarının sənin din və hökmlərini qorumayıb puç etmələrindən) **qorxuram,** (وَكَانَتِ امْرَاَتي عَاقِرًا) **- arvadım da qısırdır** (özü də qocalıbdır)**.** (فَهَبْ لي مِنْ لَدُنْكَ وَلِيًّا يَرِثُني وَيَرِثُ مِنْ اٰلِ يَعْقُوبَ) – (ey mənim rəbbim, səbəbsiz yerə) **lütf və rəhmətindən mənə, Yaqub ailəsinə varis olan bir oğul bəxş et.** (Yəni peyğəmbərliyə varis olsun, dünya malına yox)**.** (وَاجْعَلْهُ رَبِّ رَضِيًّا) – (ey mənim rəbbim, onu müttəqilərdən et ki, hər bir əməlindən) **razı olasan.** (Xilaf əməl etməsin)**.**

**7)** (يَا زَكَرِيَّا اِنَّا نُبَشِّرُكَ بِغُلَامٍ اسْمُهُ يَحْيٰى) **-** (Zəkəriyya dua edib övlad istədikdə Allah-Təala ona buyurdu:) **ey Zəkəriyya,** (sənin duanı qəbul edib)**, həqiqətən, biz səni bir oğulla müjdələyirik ki, adı Yəhyadır.** (Yəni onun adını Yəhya qoyarsan)**.** (لَمْ نَجْعَلْ لَهُ مِنْ قَبْلُ سَمِيًّا) **- bundan əvvəl** (ümmətlərə Yəhya adı) **verməmişik,** (bundan qabaq bu adda onun adaşı olmayıbdır)**.**

**8)** (قَالَ رَبِّ اَنّٰى يَكُونُ لي غُلَامٌ وَكَانَتِ امْرَاَتي عَاقِرًا) – (Zəkəriyyanın duası qəbul olub Allah-Təalanın ona verdiyi oğul vədinin vaxtı gəldikdə Zəkəriyya istədi ki, özü və arvadı qoca olduğundan necə uşaq sahibi olacaqlarını öyrənsin. Və xalqa da Allah-Təalanın kamil qüdrəti aşkar olsun. O səbəbdən Allah-Təalaya bu sualı verdi. Ayənin mənası belədir: Zəkəriyya) **dedi: ey mənim rəbbim, mənim necə oğlum olar, halbuki arvadım qısır** (və qocadır?) (وَقَدْ بَلَغْتُ مِنَ الْكِبَرِ عِتِيًّا) **- özüm də həqiqətən, qocalığın sonuna çatıb,** (övlad sahibi olmağa ümidimi itirmişəm. Bədənim quruyub, sümüklərim zəifləyib, quru ağac kimi olmuşam. İlahi, mənə məlum et ki, necə övladım olacaq?)

قَالَ كَذٰلِكَۚ قَالَ رَبُّكَ هُوَ عَلَيَّ هَيِّنٌ وَقَدْ خَلَقْتُكَ مِنْ قَبْلُ وَلَمْ تَكُ شَيْـًٔا ﴿٩﴾ قَالَ رَبِّ اجْعَلْ لِّي
اٰيَةًۜ قَالَ اٰيَتُكَ اَلَّا تُكَلِّمَ النَّاسَ ثَلٰثَ لَيَالٍ سَوِيًّا ﴿١٠﴾ فَخَرَجَ عَلٰى قَوْمِهٖ مِنَ الْمِحْرَابِ فَاَوْحٰٓى اِلَيْهِمْ
اَنْ سَبِّحُوا بُكْرَةً وَعَشِيًّا ﴿١١﴾ يَا يَحْيٰى خُذِ الْكِتَابَ بِقُوَّةٍۜ وَاٰتَيْنَاهُ الْحُكْمَ صَبِيًّاۙ ﴿١٢﴾ وَحَنَانًا مِنْ
لَدُنَّا وَزَكٰوةًۜ وَكَانَ تَقِيًّاۙ ﴿١٣﴾ وَبَرًّا بِوَالِدَيْهِ وَلَمْ يَكُنْ جَبَّارًا عَصِيًّا ﴿١٤﴾

---

**9)** (قَالَ كَذٰلِكَ) **-** (Allah-Təala Zəkəriyyanın sözünü təsdiq edib) **dedi:** (ey Zəkəriyya)**, dediyin kimidir,** (qoca kişinin və qoca arvadın övladı olmaz)**.** (قَالَ رَبُّكَ هُوَ عَلَيَّ هَيِّنٌ) – (amma) **sənin rəbbin Allah-Təala deyir ki,** (sənə oğul vermək)**, mənim üçün çox asandır.** (وَقَدْ خَلَقْتُكَ مِنْ قَبْلُ وَلَمْ تَكُ شَيْـًٔا) **- həqiqətən,** (ey Zəkəriyya)**, bundan əvvəl heç bir şey olmadığın halda, mən səni** (Yəhya-dan) **qabaq yaratdım,** (hərçənd Yəhya qocalardan dünyaya gələcəkdir, amma səninlə Yəhyanın yaradılması arasında mənim üçün heç bir fərq yoxdur)**.**

**10)** (قَالَ رَبِّ اجْعَلْ لِّي اٰيَةً) – (Zəkəriyya) **dedi: "Ey mənim rəbbim, mənə bir əlamət ver** (ki, o əlamətlə arvadımın Yəhyaya hamilə qaldığı vaxtı bilim)**.** (قَالَ اٰيَتُكَ اَلَّا تُكَلِّمَ النَّاسَ ثَلٰثَ لَيَالٍ سَوِيًّا) – (Allah-Təala) **buyurdu:** (ey Zəkəriyya) **sənin əlamətin budur ki, 3 gün, 3 gecə, bütün əzaların və dilin salamat olduğu halda, danışmağa qadir olmazsan."** (Təyin edilən o vaxt gəlib, Zəkəriyya-nın arvadı Yəhyaya hamilə olduqda, Zəkəriyyanın dili tutulub danışa bilmədi, amma ibadət edib Allah-Təalanı zikr edə bilirdi)**.**

**11)** (فَخَرَجَ عَلٰى قَوْمِهٖ مِنَ الْمِحْرَابِ) – (Zəkəriyya məbəddə olanda camaat onu gözləyirdi)**. Mehrabdan** (məbəddən) **çıxıb qövmünə tərəf getdi.** (فَاَوْحٰٓى اِلَيْهِمْ اَنْ سَبِّحُوا بُكْرَةً وَعَشِيًّا) – (Zəkəriyyanın dili tutulduğuna görə)**, işarə ilə öz qövmünə bildirdi ki, səhər-axşam Allah-Təalanı zikr edib** (təqdis edib, namaz qılın)**.**

**12)** (يَا يَحْيٰى خُذِ الْكِتَابَ بِقُوَّةٍ) – (doğuş vaxtı gəlib çatdıqda, Yəhya dünyaya gəldi, bir neçə ildən sonra həddi-büluğa çatmamış Allah-Təala ona elm və hikmət bəxş edib xitab etdi:) **ey Yəhya,** (Tövrat) **kitabına möhkəm yapışıb** (Allah-Təalanın yardımı ilə onda olan hökmlərə əməl et)**.** (وَاٰتَيْنَاهُ الْحُكْمَ صَبِيًّا) – **biz uşaq ikən ona** (dində fəqih olub Tövrat hökmlərini anlama) **hikmətini bəxş etdik.**

**13)** (وَحَنَانًا مِنْ لَدُنَّا وَزَكٰوةً وَكَانَ تَقِيًّا) **– və öz tərəfimizdən ona** (hər kəsə) **meh-riban olmağı və** (zahiri, mənəvi) **paklıq bəxş etdik.** (Yəhya müttəqi şəxs olub, hər bir şər əməldən, kiçik və böyük günahlardan çəkinən idi. İbn Abbas-dan belə rəvayət olunub: "Uşaq vaxtı Yəhyanı uşaqlar oynamağa çağıranda o, deyərdi: "Biz oynamaq üçün yaradılmamışıq")**.**

**14)** (وَبَرًّا بِوَالِدَيْهِ وَلَمْ يَكُنْ جَبَّارًا عَصِيًّا) – (Yəhya) **ata- anasına itaət və ehsan edən olub, zalım** (və təkəbbürlü, Allah-Təalaya qarşı) **asi deyildi.**

وَسَلَامٌ عَلَيْهِ يَوْمَ وُلِدَ وَيَوْمَ يَمُوتُ وَيَوْمَ يُبْعَثُ حَيًّا ﴿١٥﴾ وَاذْكُرْ فِي الْكِتَابِ مَرْيَمَ اِذِ انْتَبَذَتْ مِنْ
اَهْلِهَا مَكَانًا شَرْقِيًّا ﴿١٦﴾ فَاتَّخَذَتْ مِنْ دُونِهِمْ حِجَابًا فَاَرْسَلْنَآ اِلَيْهَا رُوحَنَا فَتَمَثَّلَ لَهَا بَشَرًا سَوِيًّا
﴿١٧﴾ قَالَتْ اِنّ۪ٓي اَعُوذُ بِالرَّحْمٰنِ مِنْكَ اِنْ كُنْتَ تَقِيًّا ﴿١٨﴾ قَالَ اِنَّمَآ اَنَا رَسُولُ رَبِّكِ لِاَهَبَ لَكِ
غُلَامًا زَكِيًّا ﴿١٩﴾ قَالَتْ اَنّٰى يَكُونُ ل۪ي غُلَامٌ وَلَمْ يَمْسَسْن۪ي بَشَرٌ وَلَمْ اَكُ بَغِيًّا ﴿٢٠﴾ قَالَ كَذٰلِكِ
قَالَ رَبُّكِ هُوَ عَلَيَّ هَيِّنٌ وَلِنَجْعَلَهُ اٰيَةً لِلنَّاسِ وَرَحْمَةً مِنَّا

---

**15)** (وَسَلَامٌ عَلَيْهِ يَوْمَ وُلِدَ وَيَوْمَ يَمُوتُ وَيَوْمَ يُبْعَثُ حَيًّا) – **doğulduğu gündə, öləcəyi gündə və qəbirdən durub məhşərə gələcəyi gündə** (bizdən Yəhyaya) **salam olsun.** (Bu 3 vaxt insanın ən çətin, dəhşətli vaxtıdır, Allah-Təala onların hər üçündə Yəhyaya rəhmət göndərib onu o 3 vaxtın dəhşətindən xatircəm edir).

**16)** (وَاذْكُرْ فِي الْكِتَابِ مَرْيَمَ اِذِ انْتَبَذَتْ مِنْ اَهْلِهَا مَكَانًا شَرْقِيًّا) - (ey Məhəmməd)**, kitabda Məryəmi zikr edib yadına sal, hansı ki o zaman öz qövmündən kənar olub** (Beytül-müqəddəsin) **şərq tərəfində** (ibadət etməkdən ötrü xəlvət) **bir yerə çəkilmişdi.**

**17)** (فَاتَّخَذَتْ مِنْ دُونِهِمْ حِجَابًا) – (özü ilə qövmünün arasına) **bir pərdə çəkdi** (ki, ibadət vaxtı onu görməsinlər). (فَاَرْسَلْنَآ اِلَيْهَا رُوحَنَا فَتَمَثَّلَ لَهَا بَشَرًا سَوِيًّا) – (Məryəm ibadətdən ötrü öz mənzilində xəlvətə çəkildikdə)**, ona öz ruhumuz** (Cəbrayılı) **göndərdik. Tam** (sağlam, gözəl) **insan surətində ona göründü.**

**18)** (قَالَتْ اِنّ۪ٓي اَعُوذُ بِالرَّحْمٰنِ مِنْكَ اِنْ كُنْتَ تَقِيًّا) – (Məryəm Cəbrayılı insan surətində görəndə, ondan qorxub iffət və ismətindən Allah-Təalaya pənah aparıb) **dedi: "Mən səndən Rəhman olan Allah-Təalaya pənah aparıram, əgər sən müttəqi şəxslərdənsənsə,** (məndən kənar olub mənə zülm etmə)**."**

**19)** (قَالَ اِنَّمَآ اَنَا رَسُولُ رَبِّكِ لِاَهَبَ لَكِ غُلَامًا زَكِيًّا) - (Cəbrayıl Məryəmin ondan qorxduğunu gördükdə) **dedi: "Həqiqətən, mən** (pənah apardığın) **rəbbin Allah-Təalanın elçisiyəm,** (hər bir eyib və günahdan) **pak olan bir oğlu sənə bağışlamaq üçün gəlmişəm."**

**20)** (قَالَتْ اَنّٰى يَكُونُ ل۪ي غُلَامٌ) - (Məryəm bu sözü eşidəndə təəccüblənib) **dedi: "Mənim necə oğlum ola bilər?** (وَلَمْ يَمْسَسْن۪ي بَشَرٌ وَلَمْ اَكُ بَغِيًّا) **- heç bir nəfər insan mənə toxunmayıb, zinakar da deyiləm."** (Necə ola bilər ki, oğlum olsun? Övlad halal, ya da haram olan əlaqədən meydana gələr, məndə isə elə bir şey yoxdur, övladım necə olacaq?)

**21)** (قَالَ كَذٰلِكِ) - (Cəbrayıl) **dedi: "Dediyin kimidir,** (ərsiz arvadın övladı olmaz)**,** (قَالَ رَبُّكِ هُوَ عَلَيَّ هَيِّنٌ) – (amma) **sənin rəbbin Allah-Təala buyurdu ki,** (sənə atasız oğul vermək) **mənim üçün çox asandır.** (وَلِنَجْعَلَهُ اٰيَةً لِلنَّاسِ وَرَحْمَةً مِنَّا) – (onu atasız yaradarıq ki,) **insanlar üçün bizim tərəfimizdən** (rəhmət və

وَكَانَ اَمْرًا مَقْضِيًّا ﴿٢١﴾ فَحَمَلَتْهُ فَانْتَبَذَتْ بِهٖ مَكَانًا قَصِيًّا ﴿٢٢﴾ فَاَجَٓاءَهَا الْمَخَاضُ اِلٰى جِذْعِ
النَّخْلَةِۚ قَالَتْ يَا لَيْتَنِي مِتُّ قَبْلَ هٰذَا وَكُنْتُ نَسْيًا مَنْسِيًّا ﴿٢٣﴾ فَنَادٰيهَا مِنْ تَحْتِهَٓا اَلَّا تَحْزَنِي قَدْ جَعَلَ
رَبُّكِ تَحْتَكِ سَرِيًّا ﴿٢٤﴾

---

qüdrətimizə işarə olan) **dəlil və sübut olsun.** (وَكَانَ اَمْرًا مَقْضِيًّا)– (ey Məryəm, bu uşağın - İsanın səndən olması Allah-Təalanın elmində sabit olan) **bir hökmdür”,** (gərək olsun)**.**

**22)** (فَحَمَلَتْهُ) – (ondan sonra Cəbrayıl ona üfləyib, Allah-Təalanın kamil qüdrəti ilə o, İsaya) **hamilə oldu.** (فَانْتَبَذَتْ بِهٖ مَكَانًا قَصِيًّا) – (Məryəmin hamilə olduğu bilindikdə, xalqdan qorxub) **uzaq bir yerə çəkildi.** (Məryəm bəni-İsraildən Yusif adlı bir şəxslə sözlənmiş idi. Yusif Məryəmin hamilə olduğunu bildikdə, özü adil bir şəxs olduğundan Məryəmi rüsvay etmək istəməyib, onu daha sonra boşamağa qərar verdi. Lakin Allah-Təala tərəfindən yuxuda ona deyildi: “Ey Yusif, onunla evlənməkdən qorxma, çünki onun bətnində olan uşaq Müqəddəs Ruhdandır. O, bir oğul doğacaq, sən onun adını İsa qoyacaqsan.” Yusif yuxudan ayıldıqdan sonra gedib Məryəm doğana qədər onu yanında saxladı. Məryəm də uşağı doğub adını İsa qoydu. İsa Yəhudiyyədə, Beytül-ləhmdə bəni-İsrail hökmdarı Herodun zamanında dünyaya gəldi. Herod bu mətləbdən xəbərdar olub İsanı axtarmağa başladı. Yusif Herodun İsanı tapıb öldürəcəyindən qorxdu. Uşağı və anasını götürüb Misirə getdi. Bir müddət Misirdə qalandan sonra Herodun Beytül-Müqəddəsdə öldüyünü eşidib, Misirdən çıxıb Şama getdi. Orada eşitdi ki, Arhel atası Herodun yerində padşah olubdur. Beytül-müqəddəsə getməkdən qorxub Nasıra adlı bir yerdə məskun oldu. Bu səbəbdən İsaya Nasiri də deyilir)**.**

**23)** (فَاَجَٓاءَهَا الْمَخَاضُ اِلٰى جِذْعِ النَّخْلَةِ) – (doğum vaxtı yaxınlaşdıqda, Məryəm qorxdu ki, birdən bilərlər, şəhərdən kənara çıxıb) **doğuş sancısından bir xurma ağacının gövdəsinə söykənməyə məcbur oldu** (ki, orada gizlənib doğsun)**.** (قَالَتْ يَا لَيْتَنِي مِتُّ قَبْلَ هٰذَا وَكُنْتُ نَسْيًا مَنْسِيًّا)- **dedi: “Kaş mən bu gündən qabaq ölüb xalqın yadından çıxaydım,** (ki, belə günü görməyəydim.” Hz. Məryəm hərçənd özünün iffət və ismətinə və Allah-Təalanın ona olan lütf və mərhəmətinə agah olub, bunda heç bir şəkk və şübhəsi yox idi. Amma insanlıq halına görə, vəziyyətinin camaat tərəfindən bilinməsindən və haqqında mənasız sözlər deməsindən utandı, necə ki indi də yəhudilər ona inanmırlar. Bu səbəbdən Məryəm iztiraba düşüb, özünün ölməsini və unudulmasını istədi)**.**

**24)** (فَنَادٰيهَا مِنْ تَحْتِهَٓا اَلَّا تَحْزَنِي) – (Məryəm İsanı doğduqda)**, aşağı tərəfdən** (Cəbrayıl Məryəmi çağırıb) **dedi: “Qəmgin olma.** (قَدْ جَعَلَ رَبُّكِ تَحْتَكِ سَرِيًّا) - **həqiqətən, sənin rəbbin Allah-Təala** (alt tərəfindən çay axıdıb) **altındakı** (uşağı) **böyük bir şəxs edəcəkdir.”**

وَهُزِّيٓ اِلَيْكِ بِجِذْعِ النَّخْلَةِ تُسَاقِطْ عَلَيْكِ رُطَبًا جَنِيًّاۘ ﴿٢٥﴾ فَكُلِي وَاشْرَبِي وَقَرِّي عَيْنًاۚ فَاِمَّا تَرَيِنَّ
مِنَ الْبَشَرِ اَحَدًاۙ فَقُولِٓي اِنّ۪ي نَذَرْتُ لِلرَّحْمٰنِ صَوْمًا فَلَنْ اُكَلِّمَ الْيَوْمَ اِنْسِيًّاۚ ﴿٢٦﴾ فَاَتَتْ بِه۪ قَوْمَهَا
تَحْمِلُهُۜ قَالُوا يَا مَرْيَمُ لَقَدْ جِئْتِ شَيْـًٔا فَرِيًّا ﴿٢٧﴾ يَٓا اُخْتَ هٰرُونَ مَا كَانَ اَبُوكِ امْرَاَ سَوْءٍ وَمَا كَانَتْ
اُمُّكِ بَغِيًّاۚ ﴿٢٨﴾ فَاَشَارَتْ اِلَيْهِۜ قَالُوا كَيْفَ نُكَلِّمُ مَنْ كَانَ فِي الْمَهْدِ صَبِيًّا ﴿٢٩﴾ قَالَ اِنّ۪ي عَبْدُ اللّٰهِۜ
اٰتٰىنِيَ الْكِتَابَ وَجَعَلَن۪ي نَبِيًّاۙ ﴿٣٠﴾

---

**25)** (وَهُزّ۪ي اِلَيْكِ بِجِذْعِ النَّخْلَةِ تُسَاقِطْ عَلَيْكِ رُطَبًا جَنِيًّا)- (təzə xurma yeni doğan qadına çox faydalı olduğundan Cəbrayıl Məryəmə xitab edib dedi: "Ey Məryəm)**, xurma ağacını özünə tərəf silkələ ki, üstünə yetişmiş xurma tökülsün.** (Ondan ye ki, çox faydası var)**.**

**26)** (فَكُل۪ي وَاشْرَب۪ي وَقَرّ۪ي عَيْنًا) - (xurma) **ye və** (çeşmənin suyundan) **iç,** (bu İsa səbəbinə) **gözün aydın,** (qəlbin aram) **olsun.** (فَاِمَّا تَرَيِنَّ مِنَ الْبَشَرِ اَحَدًا) – (ey Məryəm, əgər səndən bu uşağı soruşan) **bir insan görsən,** (فَقُول۪ٓي اِنّ۪ي نَذَرْتُ لِلرَّحْمٰنِ صَوْمًا فَلَنْ اُكَلِّمَ الْيَوْمَ اِنْسِيًّا) – (yəhudilər arasında sükut orucu tutmaq adəti olduğundan Cəbrayıl Məryəmə əmr edir ki, işarə ilə onlara belə) **de: "Mən həqiqətən, nəzir etmişəm ki, bu gün Allah-Təala üçün** (sükut) **orucu tutub, heç bir insanla da danışmayacağam."**

**27)** (فَاَتَتْ بِه۪ قَوْمَهَا تَحْمِلُهُ) – (Məryəm Allah-Təaladan Cəbrayıl vasitəsilə bu sözləri eşitdikdə, qəlbi aram olub İsanı) **götürüb qövmünün yanına getdi.** (قَالُوا يَا مَرْيَمُ لَقَدْ جِئْتِ شَيْـًٔا فَرِيًّا) – (Məryəmin qohum-əqrəbası uşağı gördükdə, namuslarına zərər gəldiyindən ağlayıb) **dedilər: "Ey Məryəm, həqiqətən, çox təəccüblü bir şeylə gəlibsən,** (bu uşaq sənin üçün haradandır?)"

**28)** (يَٓا اُخْتَ هٰرُونَ مَا كَانَ اَبُوكِ امْرَاَ سَوْءٍ) **- ey Harunun bacısı,** (Harun Məryəmin qardaşı olub, saleh bir şəxs idi. Qınamaq üçün belə deyirlər ki, Harun kimi bir şəxsin bacısından da belə qəbih əməl meydana gələrmi?) **sənin atan** (İmran günah edən) **pis bir kişi deyildi.** (وَمَا كَانَتْ اُمُّكِ بَغِيًّا) **- və anan da zinakar deyildi,** (bu nə əməldir edibsən? Bu uşaq haradandır?)

**29)** (فَاَشَارَتْ اِلَيْهِ) – (Məryəm danışmama orucu tutduğundan İsaya) **işarə etdi.** (Yəni uşaqdan soruşun, sizə cavab versin. Onlar bu sözdən qəzəblənib dedilər: onun bizə uşaq ilə danışmağı təklif edib istehza etməsi etdiyi əməlindən də ağırdır)**.** (قَالُوا كَيْفَ نُكَلِّمُ مَنْ كَانَ فِي الْمَهْدِ صَبِيًّا) **- dedilər:** (ey Məryəm, sən bizə istehza edirsən)**, beşikdəki bir uşaqla necə danışaq?**

**30)** (قَالَ اِنّ۪ي عَبْدُ اللّٰهِ) – (beşikdəki İsa onların sözlərini eşitdikdə, Allah-Təalanın izniylə danışıb) **dedi: "Həqiqətən, mən Allah-Təalanın quluyam.** (اٰتٰىنِيَ الْكِتَابَ وَجَعَلَن۪ي نَبِيًّا) **- mənə kitab** (İncil) **verib və məni peyğəmbər edibdir.** (Yəni Allah-Təala mənə kitab verib peyğəmbər edəcəkdir)**.**

وَجَعَلَنِي مُبَارَكًا اَيْنَ مَا كُنْتُ وَاَوْصَانِي بِالصَّلٰوةِ وَالزَّكٰوةِ مَا دُمْتُ حَيًّا ﴿٣١﴾ وَبَرًّا بِوَالِدَتِي
وَلَمْ يَجْعَلْنِي جَبَّارًا شَقِيًّا ﴿٣٢﴾ وَالسَّلَامُ عَلَيَّ يَوْمَ وُلِدْتُ وَيَوْمَ اَمُوتُ وَيَوْمَ اُبْعَثُ حَيًّا ﴿٣٣﴾
ذٰلِكَ عِيسَى ابْنُ مَرْيَمَ قَوْلَ الْحَقِّ الَّذِي فِيهِ يَمْتَرُونَ ﴿٣٤﴾ مَا كَانَ لِلّٰهِ اَنْ يَتَّخِذَ مِنْ وَلَدٍ سُبْحَانَهُ
اِذَا قَضٰى اَمْرًا فَاِنَّمَا يَقُولُ لَهُ كُنْ فَيَكُونُ ﴿٣٥﴾ وَاِنَّ اللّٰهَ رَبِّي وَرَبُّكُمْ فَاعْبُدُوهُ هٰذَا صِرَاطٌ
مُسْتَقِيمٌ ﴿٣٦﴾

---

**31)** (وَجَعَلَنِي مُبَارَكًا اَيْنَ مَا كُنْتُ) – **harda olsam da, Allah-Təala məni mübarək** (xeyir və mənfəət verən) **edibdir.** (وَاَوْصَانِي بِالصَّلٰوةِ وَالزَّكٰوةِ مَا دُمْتُ حَيًّا) – **həyatda olduğum müddətdə də Allah-Təala mənə vəsiyyət edib ki, gərək, namaz qılıb zəkat verəm.** (Gərək bu iki şeyi edim)**.**

**32)** (وَبَرًّا بِوَالِدَتِي وَلَمْ يَجْعَلْنِي جَبَّارًا شَقِيًّا) – (yenə Allah-Təala mənə vəsiyyət edib ki,) **anama ehsan edib itaət edəm.** (Allah-Təala) **məni təkəbbürlü** (zalım) **və asi etməyibdir.**

**33)** (وَالسَّلَامُ عَلَيَّ يَوْمَ وُلِدْتُ وَيَوْمَ اَمُوتُ وَيَوْمَ اُبْعَثُ حَيًّا) **- doğulduğum gündə, öləcəyim gündə və dirilib** (məhşərə gedəcəyim) **gündə Allah-Təaladan mənə salam olsun.”** (İsanın sözü bitdi. Ondan sonra İsa digər uşaqlar kimi böyüyənə qədər danışmadı)**.**

**34)** (ذٰلِكَ عِيسَى ابْنُ مَرْيَمَ قَوْلَ الْحَقِّ) - (ey Məhəmməd)**, bu İsa Məryəm oğludur,** (onun əhvalatı sənə nəql olundu)**, Allah-Təalanın haqq sözüdür,** (atasız yaradıldığından ona “kəlimətullah” – “Allahın sözü” deyilir, yəni ancaq Allah-Təalanın iradəsiylə yaradılıbdır)**.** (الَّذِي فِيهِ يَمْتَرُونَ) – (bu o İsadır ki,) **onun haqqında şəkk edib** (nalayiq sözlər deyirlər. Yəni bəziləri deyir ki, o, Allah-Təalanın oğludur, bəziləri də onun peyğəmbərliyini qəbul etməyib, xəbis olan şeyləri ona isnad edirlər)**.**

**35)** (مَا كَانَ لِلّٰهِ اَنْ يَتَّخِذَ مِنْ وَلَدٍ) – (xristianların dediyi kimi) **Allaha övlad götürmək yaraşmaz.** (سُبْحَانَهُ اِذَا قَضٰى اَمْرًا فَاِنَّمَا يَقُولُ لَهُ كُنْ فَيَكُونُ) **- Allah-Təala** (məxluqat kimi övlad sahibi olmaqdan) **pak və müqəddəsdir, O, bir şeyin olmasını hökm etdikdə, ona – ol, deyər və o da dərhal olar.** (İsa da Allah-Təalanın əmriylə atasız dünyaya gəlibdir, ona Allahın oğlu demək səhvdir. Allah-Təalanın bir şeyi yaratması üçün sözə də ehtiyacı yoxdur, ayədə belə deməsi bizə bildirməkdən ötrüdür, yoxsa sadəcə istəməsi kifayətdir)**.**

**36)** (وَاِنَّ اللّٰهَ رَبِّي وَرَبُّكُمْ فَاعْبُدُوهُ هٰذَا صِرَاطٌ مُسْتَقِيمٌ) - (İsa özü xalqa belə deyir:) **həqiqətən, mənim rəbbim və sizin rəbbiniz Allah-Təaladır, Ona ibadət edin, düz** (nicat) **yolu ancaq budur.** (İsa özü belə deyəndə necə demək olar ki, İsa Allah, ya da Allah-Təalanın oğludur)**.**

فَاخْتَلَفَ الْاَحْزَابُ مِنْ بَيْنِهِمْۚ فَوَيْلٌ لِلَّذ۪ينَ كَفَرُوا مِنْ مَشْهَدِ يَوْمٍ عَظ۪يمٍ ﴿٣٧﴾ اَسْمِعْ بِهِمْ وَاَبْصِرْۙ
يَوْمَ يَأْتُونَنَا لٰكِنِ الظَّالِمُونَ الْيَوْمَ ف۪ي ضَلَالٍ مُب۪ينٍ ﴿٣٨﴾ وَاَنْذِرْهُمْ يَوْمَ الْحَسْرَةِ اِذْ قُضِيَ الْاَمْرُۘ
وَهُمْ ف۪ي غَفْلَةٍ وَهُمْ لَا يُؤْمِنُونَ ﴿٣٩﴾ اِنَّا نَحْنُ نَرِثُ الْاَرْضَ وَمَنْ عَلَيْهَا وَاِلَيْنَا يُرْجَعُونَ ﴿٤٠﴾
وَاذْكُرْ فِي الْكِتَابِ اِبْرٰه۪يمَۜ اِنَّهُ كَانَ صِدّ۪يقًا نَبِيًّا ﴿٤١﴾ اِذْ قَالَ لِاَب۪يهِ يَٓا اَبَتِ لِمَ تَعْبُدُ مَا لَا يَسْمَعُ وَلَا
يُبْصِرُ وَلَا يُغْن۪ي عَنْكَ شَيْـًٔا ﴿٤٢﴾

---

**37)** (فَاخْتَلَفَ الْاَحْزَابُ مِنْ بَيْنِهِمْ) - (xristian) **firqələri** (İsa haqqında) **öz aralarında ixtilaf etdilər,** (yəni bəzisi dedi: "O, Allahdır", bəzisi dedi: "O, Allah-Təalanın oğludur", bəzisi də dedi: "O, peyğəmbərdir." Ona xəbis xüsusiyyətlər də isnad etdilər). (فَوَيْلٌ لِلَّذ۪ينَ كَفَرُوا مِنْ مَشْهَدِ يَوْمٍ عَظ۪يمٍ) – **o böyük** (qiyamət) **gününü görən,** (İsanı) **inkar edən şəxslərin vay halına,** (dəhşətli əzab olsun onlara).

**38)** (اَسْمِعْ بِهِمْ وَاَبْصِرْ يَوْمَ يَأْتُونَنَا) – (dünyada İsa haqqında ixtilaf edənlər haqqı eşidib görməkdən kar və kor olurdular). **Amma bizim tərəfimizə gəldikləri gün** (qiyamət günü) **elə yaxşı eşidib və elə yaxşı görəcəklər ki!** (Lakin onlara bir faydası olmaz). (لٰكِنِ الظَّالِمُونَ الْيَوْمَ ف۪ي ضَلَالٍ مُب۪ينٍ) - **lakin** (İsa haqqında ixtilaf edən bu) **zalımlar bugünkü gündə** (dünyada) **açıq-aşkar zəlalətdə olub,** (haqqı eşidib görməkdən kar, kor olublar).

**39)** (وَاَنْذِرْهُمْ يَوْمَ الْحَسْرَةِ اِذْ قُضِيَ الْاَمْرُ) - (ey Məhəmməd, kafirləri) **həsrət çəkib peşman olacaqları bir günlə qorxut, işləri bitdikdə** (behişt əhli behiştə, cəhənnəm əhli cəhənnəmə gedər, ogünkü gündə cəhənnəm əhlindən ötrü nə qədər peşmançılıq vardır). (وَهُمْ ف۪ي غَفْلَةٍ وَهُمْ لَا يُؤْمِنُونَ) – (indi onlar bu dünyada) **qəflət içində olub, iman gətirmirlər,** (amma qiyamət günündə bunun peşmançılığını çəkəcəklər).

**40)** (اِنَّا نَحْنُ نَرِثُ الْاَرْضَ وَمَنْ عَلَيْهَا وَاِلَيْنَا يُرْجَعُونَ) - (ey Məhəmməd), **həqiqətən, yer üzünə və onun üstündəkilərə** (məxluqata) **təkcə biz özümüz varis olub,** (onları həlak edib yenidən qiyamət günündə) **bizim tərəfimizə qaytarılacaqlar.** (Hər bir şəxsə öz əməlinin cəzası veriləcəkdir).

**41)** (وَاذْكُرْ فِي الْكِتَابِ اِبْرٰه۪يمَ اِنَّهُ كَانَ صِدّ۪يقًا نَبِيًّا) - (ey Məhəmməd), **bu** (Quran) **kitabında İbrahimi** (və onun qissəsini xalqa oxuyub) **bəyan et, həqiqətən, İbrahim doğru bir şəxs və** (bizim tərəfimizdən olan) **bir peyğəmbər idi.**

**42)** (اِذْ قَالَ لِاَب۪يهِ يَٓا اَبَتِ لِمَ تَعْبُدُ مَا لَا يَسْمَعُ وَلَا يُبْصِرُ وَلَا يُغْن۪ي عَنْكَ شَيْـًٔا) – (Hz. İbrahim təbliğə başladıqda, əvvəlcə atasını dəvət etdi, çünki insan ən yaxşı şeyi öncə öz ailəsi üçün istəyər, ailədə də ən əziz şəxs ata olduğundan Hz. İbrahim öncə atasını tövhidə dəvət etdi, ayənin mənası belədir: o zaman ki İbrahim öz atasına) **dedi: "Ey mənim atam, niyə heç nə eşitməyib, görməyən, sənə bir fayda da verməyən bir şeyə ibadət edirsən?** (Ağıllı şəxs də belə şeyə ibadət edərmi? Atası bütpərəst olduğundan onu bu şəkildə dəvət edir).

يَآ اَبَتِ اِنّي قَدْ جَآءَني مِنَ الْعِلْمِ مَا لَمْ يَأْتِكَ فَاتَّبِعْني اَهْدِكَ صِرَاطًا سَوِيًّا ﴿٤٣﴾ يَآ اَبَتِ لَا تَعْبُدِ الشَّيْطَانَ اِنَّ الشَّيْطَانَ كَانَ لِلرَّحْمٰنِ عَصِيًّا ﴿٤٤﴾ يَآ اَبَتِ اِنّيٓ اَخَافُ اَنْ يَمَسَّكَ عَذَابٌ مِنَ الرَّحْمٰنِ فَتَكُونَ لِلشَّيْطَانِ وَلِيًّا ﴿٤٥﴾

---

**43)** (يَا اَبَتِ اِنّي قَدْ جَاءَني مِنَ الْعِلْمِ مَا لَمْ يَأْتِكَ) **- ey mənim atam, həqiqətən, Allah-Təala tərəfindən mənə gələn elm sənə gəlməyibdir.** (Elmin şərəfinə bu kifayət edər ki, Hz. İbrahim elm səbəbinə atasına deyir ki, gəl, mənə tabe ol)**.** (فَاتَّبِعْني اَهْدِكَ صِرَاطًا سَوِيًّا) – (elm səbəbinə mənim dinimə) **tabe ol ki, səni düz yola** (haqq tərəfinə) **hidayət edim.**

**44)** (يَا اَبَتِ لَا تَعْبُدِ الشَّيْطَانَ اِنَّ الشَّيْطَانَ كَانَ لِلرَّحْمٰنِ عَصِيًّا) **- Ey mənim atam, şeytana ibadət edib** (Allah-Təalaya şərik qoşma)**. Həqiqətən, şeytan Allah-Təalaya asi olub** (onun itaətindən çıxıbdır)**.**

**45)** (يَا اَبَتِ اِنّي اَخَافُ اَنْ يَمَسَّكَ عَذَابٌ مِنَ الرَّحْمٰنِ) **- Ey mənim atam, həqiqətən, mən qorxuram ki,** (əgər küfrdə qalsan)**, Allah-Təaladan sənə bir əzab toxunsun.** (فَتَكُونَ لِلشَّيْطَانِ وَلِيًّا) **- o vaxt da * şeytanın dostlarından olarsan.** (Çünki şeytanın yoldaşlarına əzab ediləcək)**.**

*(*Qeyd: Hz. İbrahimin atasıyla rəftarına fikir verilsin, atasına nəsihət edib onu qəbih əməldən, şirkdən döndərib, yeganə olan Allah-Təalaya itaət etməsi üçün onunla necə təvazökarlıqla və gözəl şəkildə rəftar edir. Allah-Təalanın - "Ey İbrahim, ey mənim dostum, kafir də olsa, xalqla yaxşı və gözəl rəftar et", nəsihətinə əməl edib, atasını gözəl şəkildə haqqa dəvət edir, əvvəlcə atasından niyə onun görüb eşitməyən şeyləri Allah-Təalaya şərik qoşduğunu soruşur. İkinci dəfə də atasını son dərəcə lütfkarlıqla və dostcasına haqqa dəvət edir, atasını cahilliklə günahlandırmayıb, özünün ancaq bir qədər elm sahibi olması ilə ona o elmlə nicat verməyi vəd edir. 3-cü dəfə isə atasını şeytana itaət və ibadət etməyi belə qadağan edir: "Ey ata, bütün məxluqatın sahibi Allah-Təalaya asi olub, təkəbbürlənən şeytana itaət etmək layiq deyil. Necə ki sən ona ibadət edib öz rəbbin Allah-Təaladan kənar olubsan." 4-cü dəfə atasını aqibətinin pis olacağı ilə, axirət əzabı ilə qorxudur və bunu edərkən də ədəbə riayət edib ona əzab ediləcəyini atasına demir. Əksinə deyir ki, bu əməlinə görə, sənə əzab edilməndən qorxuram. Hz. İbrahimin atasına etdiyi nəsihətləri Allah-Təalanın Qurani-Şərifdə qeyd etməkdə məqsədi odur ki, müsəlmanlar o nəsihətlərə fikir verib xeyri əmr, şəri qadağan edəndə Hz. İbrahimin yoluna tabe olsunlar. Bir də elmin qədrini, şərəfini dərk edib elm dalınca getməkdə tənbəllik etməsinlər. Baxıb fikir versinlər ki, Hz. İbrahim atasını dəvət edəndə necə elmə əsaslanıb atasına deyir: "Məndə olan elmə görə, gərək, mənə tabe olasan." Çünki insanı hər bir təhlükədən elm qoruyub nicat verər. Cəhalət isə ən alçaq səviyyəyə salıb əzaba düçar edər. Atasına deyir ki, səndə elm yoxdur, amma məndə var. Əgər səndə elm olub məndə olmasaydı, hər halda mən sənə tabe olardım. Gərək, məndə olan elmin şüasına tabe olub sən də işıqlanasan. Bəli, elm çox böyük şeydir, Allah-Təala özünü elm səbəbilə məxluqata üstün sayır. Buyurur*

قَالَ اَرَاغِبٌ اَنْتَ عَنْ اٰلِهَتِي يَٓا اِبْرٰهِيمُۚ لَئِنْ لَمْ تَنْتَهِ لَاَرْجُمَنَّكَ وَاهْجُرْنِي مَلِيًّا ﴿٤٦﴾ قَالَ سَلَامٌ
عَلَيْكَۚ سَاَسْتَغْفِرُ لَكَ رَبّٖيۜ اِنَّهُ كَانَ بِي حَفِيًّا ﴿٤٧﴾ وَاَعْتَزِلُكُمْ وَمَا تَدْعُونَ مِنْ دُونِ اللّٰهِ وَاَدْعُوا رَبّٖيۘ
عَسٰٓى اَلَّٓا اَكُونَ بِدُعَٓاءِ رَبّٖي شَقِيًّا ﴿٤٨﴾ فَلَمَّا اعْتَزَلَهُمْ وَمَا يَعْبُدُونَ مِنْ دُونِ اللّٰهِۙ وَهَبْنَا لَهُٓ اِسْحٰقَ
وَيَعْقُوبَۜ وَكُلًّا جَعَلْنَا نَبِيًّا ﴿٤٩﴾

---

*ki, Allah-Təala hər bir şeydən agahdır, amma siz agah deyilsiniz. Ərəblər arasından çıxan Hz. Peyğəmbərin dininin yer kürəsinin əksər yerlərində yayılıb, islam ümmətinin onun çırağı ilə aydınlanmasının səbəbi o cənabın elmi deyilmi?)*

**46)** (قَالَ اَرَاغِبٌ اَنْتَ عَنْ اٰلِهَتِي يَٓا اِبْرٰهِيمُ) – (Hz. İbrahimin atası küfr və inadından İbrahimə qəzəblə cavab verib, onun “ey mənim atam” deməsinin müqabilində “ey mənim oğlum” deməyib onu ədəblə çağırıb) **dedi: “**(ey İbrahim)**, bəs sən mənim tanrılarımdan üz döndərib** (onların ibadətini tərk edirsən?) (لَئِنْ لَمْ تَنْتَهِ لَاَرْجُمَنَّكَ) – (ey İbrahim)**, əgər** (dediyin sözləri tərk edib buna) **son qoymasan, əlbəttə, səni daşla vurub** (həlak edərəm)**.** (وَاهْجُرْنِي مَلِيًّا) **- nə qədər ki, ömrün var, məndən uzaq ol,** (mənə belə sözləri demə)**.”**

**47)** (قَالَ سَلَامٌ عَلَيْكَ) **-** (Hz. İbrahim atasının pis sözünə lütfkarlıqla, mehribanlıqla cavab verib) **dedi: “**(ey ata)**, salam olsun sənə,** (qəzəblənmə, gəl haqqa tabe olub Allah-Təalaya itaət et)**,** (سَاَسْتَغْفِرُ لَكَ رَبّٖي اِنَّهُ كَانَ بِي حَفِيًّا) – (ey ata)**, rəbbim Allah-Təaladan səni bağışlamasını diləyirəm, həqiqətən, Allah-Təalanın mənə çox lütf və mərhəməti var,** (duamı qəbul edib sənin təqsirindən keçər, gəl Allah-Təalaya iman edib itaət et.” İbrahim atası üçün bağışlanma diləsə də, Allah-Təala onun istəyini qəbul etmədi, çünki müşriklərin bağışlanmasını diləmək caiz deyil. Necə ki Bəraət surəsində daha əvvəl xəbər verilmişdi)**.**

**48)** (وَاَعْتَزِلُكُمْ وَمَا تَدْعُونَ مِنْ دُونِ اللّٰهِ) **-** (İbrahim atasına və qövmünə xitab edib deyir: “İndi ki, iman gətirmədiniz)**, sizdən və Allah-Təaladan başqa ibadət etdiyiniz** (bütlərinizdən) **kənar olub,** (hicrət edib Şama gedərəm)**.** (وَاَدْعُوا رَبّٖي عَسٰٓى اَلَّٓا اَكُونَ بِدُعَٓاءِ رَبّٖي شَقِيًّا) **- öz rəbbim Allah-Təalaya ibadət edirəm. Ümidvaram ki, rəbbim Allah-Təalaya ibadət etməklə asilərdən olmayım.** (Necə ki siz bütlərə ibadət etməklə asilərdən hesab olunursunuz, Hz.İbrahim atasının və qövmünün iman etməsindən ümidini kəsib, Babildən gedib müqəddəs Şam torpağında məskun oldu)**.**

**49)** (فَلَمَّا اعْتَزَلَهُمْ وَمَا يَعْبُدُونَ مِنْ دُونِ اللّٰهِ) – (Hz. İbrahim onlardan və ibadət etdikləri bütlərdən) **ayrılıb** (Şamda sakin olduqda)**,** (وَهَبْنَا لَهُٓ اِسْحٰقَ وَيَعْقُوبَ) **-** (arvadı Saradan) **İshaqı və** (İshaqdan olan) **Yaqubu ona bəxş etdik.** (Hz. İbrahim İshaqın oğlu Yaqubu görüb ondan sonra vəfat etdi)**.** (وَكُلًّا جَعَلْنَا نَبِيًّا) **– onların hər ikisini** (İshaqı və Yaqubu) **peyğəmbər etdik.**

وَوَهَبْنَا لَهُمْ مِنْ رَحْمَتِنَا وَجَعَلْنَا لَهُمْ لِسَانَ صِدْقٍ عَلِيًّاۚ ﴿٥٠﴾ وَاذْكُرْ فِي الْكِتَابِ مُوسٰىٓ اِنَّهُ كَانَ مُخْلَصًا وَكَانَ رَسُولًا نَبِيًّا ﴿٥١﴾ وَنَادَيْنَاهُ مِنْ جَانِبِ الطُّورِ الْاَيْمَنِ وَقَرَّبْنَاهُ نَجِيًّا ﴿٥٢﴾ وَوَهَبْنَا لَهُ مِنْ رَحْمَتِنَٓا اَخَاهُ هٰرُونَ نَبِيًّا ﴿٥٣﴾ وَاذْكُرْ فِي الْكِتَابِ اِسْمٰعِيلَۘ اِنَّهُ كَانَ صَادِقَ الْوَعْدِ وَكَانَ رَسُولًا نَبِيًّاۚ ﴿٥٤﴾ وَكَانَ يَأْمُرُ اَهْلَهُ بِالصَّلٰوةِ وَالزَّكٰوةِۖ وَكَانَ عِنْدَ رَبِّهِ مَرْضِيًّا ﴿٥٥﴾ وَاذْكُرْ فِي الْكِتَابِ اِدْرِيسَۘ اِنَّهُ كَانَ صِدّٖيقًا نَبِيًّاۗ ﴿٥٦﴾ وَرَفَعْنَاهُ مَكَانًا عَلِيًّا ﴿٥٧﴾

---

**50)** (وَوَهَبْنَا لَهُمْ مِنْ رَحْمَتِنَا) **- onlara öz rəhmətimizdən** (din və dünyanın hər bir xeyir və mənfəətini) **bəxş etdik.** (وَجَعَلْنَا لَهُمْ لِسَانَ صِدْقٍ عَلِيًّا)– (hər bir millətin arasında) **onları doğru dilli və uca mərtəbə sahibi etdik.** (Hər bir millət onları gözəl şəkildə yad edib, özlərinə dost və rəhbər etdi)**.**

**51)** (وَاذْكُرْ فِي الْكِتَابِ مُوسٰى) **-** (ey Məhəmməd)**, bu** (Quran) **kitabında Musanın** (əhvalatını da) **yad edib** (xalqa çatdır)**.** (اِنَّهُ كَانَ مُخْلَصًا وَكَانَ رَسُولًا نَبِيًّا) **- həqiqətən,** (Musa Allah-Təala tərəfindən seçilmiş) **ixlaslı bir şəxs, elçi və peyğəmbər idi.**

**52)** (وَنَادَيْنَاهُ مِنْ جَانِبِ الطُّورِ الْاَيْمَنِ) – (Musa oddan ötrü Tura getdikdə, orada Musaya) **Tur dağının sağ tərəfindən səsləndik.** (وَقَرَّبْنَاهُ نَجِيًّا) – (danışmaq üçün bizə) **dua etdiyi bir halda onu özümüzə yaxınlaşdırdıq.**

**53)** (وَوَهَبْنَا لَهُ مِنْ رَحْمَتِنَٓا اَخَاهُ هٰرُونَ نَبِيًّا) **- öz lütf və rəhmətimizdən qardaşı Harunu peyğəmbər olaraq ona** (köməkçi kimi) **bəxş etdik.**

**54)** (وَاذْكُرْ فِي الْكِتَابِ اِسْمٰعِيلَ) **-** (ey Məhəmməd)**, bu (Quran) kitabında İsmayılı** (xalqdan ötrü) **yad et.** (اِنَّهُ كَانَ صَادِقَ الْوَعْدِ) **- həqiqətən, o** (İsmayıl) **vədində sadiq olan bir şəxs idi.** (Hərçənd bütün peyğəmbərlər vədlərində sadiq idilər, amma İsmayılın şərəfini göstərmək üçün Allah-Təala onu bu xüsusiyyətlə yad edir. Hz. İsmayıl bir dəfə birinə vəd etdi ki, bu yerdə səni gözləyəcəyəm. O şəxs gəlmədi, İsmayıl o şəxsi orada bir gün, bir gecə gözlədi)**.** (وَكَانَ رَسُولًا نَبِيًّا) **– o,** (Allah-Təala tərəfindən) **bir elçi və peyğəmbər idi.**

**55)** (وَكَانَ يَأْمُرُ اَهْلَهُ بِالصَّلٰوةِ وَالزَّكٰوةِ) – (İsmayıl) **öz ailəsinə** (və ümmətinə) **namaz qılıb zəkat verməyi əmr edərdi.** (Belə ki, özgələr də onlara baxıb namaz və zəkatı yerinə yetirsinlər)**.** (وَكَانَ عِنْدَ رَبِّهِ مَرْضِيًّا) **- rəbbi Allah-Təala da onun hər bir əməlindən razı idi,** (o, itaətin ən yüksək səviyyəsinə çatmışdı)**.**

**56)** (وَاذْكُرْ فِي الْكِتَابِ اِدْرِيسَ اِنَّهُ كَانَ صِدّٖيقًا نَبِيًّا) **-** (ey Məhəmməd)**, bu** (Quran) **kitabında İdris** (peyğəmbərin əhvalatını xalqdan ötrü) **yad et. Həqiqətən, o** (İdris) **doğru adam olub,** (Allah-Təala tərəfindən) **bir peyğəmbər idi.**

**57)** (وَرَفَعْنَاهُ مَكَانًا عَلِيًّا) **- ucaldıb onu böyük məqam və mərtəbəyə** (peyğəmbər mərtəbəsinə) **çatdırdıq.**

أُولٰٓئِكَ الَّذِينَ اَنْعَمَ اللّٰهُ عَلَيْهِمْ مِنَ النَّبِيّنَ مِنْ ذُرِّيَّةِ اٰدَمَ وَمِمَّنْ حَمَلْنَا مَعَ نُوحٍ وَمِنْ ذُرِّيَّةِ اِبْرٰهِيمَ وَاِسْرَآءِيلَ
وَمِمَّنْ هَدَيْنَا وَاجْتَبَيْنَاۜ اِذَا تُتْلٰى عَلَيْهِمْ اٰيَاتُ الرَّحْمٰنِ خَرُّوا سُجَّدًا وَبُكِيًّا ﴿٥٨﴾ فَخَلَفَ مِنْ بَعْدِهِمْ
خَلْفٌ اَضَاعُوا الصَّلٰوةَ وَاتَّبَعُوا الشَّهَوَاتِ فَسَوْفَ يَلْقَوْنَ غَيًّاۙ ﴿٥٩﴾ اِلَّا مَنْ تَابَ وَاٰمَنَ وَعَمِلَ صَالِحًا
فَاُولٰٓئِكَ يَدْخُلُونَ الْجَنَّةَ وَلَا يُظْلَمُونَ شَيْـًٔاۙ ﴿٦٠﴾ جَنَّاتِ عَدْنٍ الَّتِي وَعَدَ الرَّحْمٰنُ عِبَادَهُ بِالْغَيْبِۜ اِنَّهُ
كَانَ وَعْدُهُ مَأْتِيًّا ﴿٦١﴾ لَا يَسْمَعُونَ فِيهَا لَغْوًا اِلَّا سَلَامًاۜ وَلَهُمْ رِزْقُهُمْ فِيهَا بُكْرَةً وَعَشِيًّا ﴿٦٢﴾

---

**58)** (اُولٰٓئِكَ الَّذِينَ اَنْعَمَ اللّٰهُ عَلَيْهِمْ مِنَ النَّبِيّنَ) **- bu** (qeyd olunan) **şəxslər** (Zəkəriyyadan İdrisə kimi) **Allah-Təalanın onlara** (bol dünya və axirət) **neməti verdiyi peyğəmbərlərdəndirlər,** (dünyada peyğəmbərliyə, axirətdə bol nemətlərə çatıb nicat taparlar). (مِنْ ذُرِّيَّةِ اٰدَمَ وَمِمَّنْ حَمَلْنَا مَعَ نُوحٍ وَمِنْ ذُرِّيَّةِ اِبْرٰهِيمَ وَاِسْرَآءِيلَ وَمِمَّنْ هَدَيْنَا وَاجْتَبَيْنَا) – (bu qeyd olunan peyğəmbərlər) **Nuhun** (gəmidə) **daşıdığı vasitəsilə Adəmin nəslindəndirlər.** (İdris Nuhla gəmidə olan şəxslərdən birinin övladıdır. İbrahim Samın nəslindəndir, Sam da Nuhun oğludur. Bəziləri də - İshaq, İsmayıl, Yaqub) **İbrahimin,** (bəziləri də - Musa, Harun, Zəkəriyyə, Yəhya, İsa) **İsrailin** (Yaqubun) **nəslindəndirlər.** (Bu peyğəmbərlər) **bizim hidayət edib seçdiyimiz şəxslərdəndirlər.** (اِذَا تُتْلٰى عَلَيْهِمْ اٰيَاتُ الرَّحْمٰنِ خَرُّوا سُجَّدًا وَبُكِيًّا) **- Allah-Təalanın ayə və ehkamları onlara** (bu peyğəmbərlərə) **oxunduqda,** (üzü üstə yıxılıb) **ağlayaraq səcdə edərdilər.**

**59)** (فَخَلَفَ مِنْ بَعْدِهِمْ خَلْفٌ اَضَاعُوا الصَّلٰوةَ وَاتَّبَعُوا الشَّهَوَاتِ) – (bu qeyd olunan peyğəmbərlərdən sonra) **elə bir** (xəbis) **nəsil** (bizim peyğəmbərin ümməti) **gəldi ki, namazı tərk edib şəhvətə tabe olub,** (hər cür günahı etdilər). (فَسَوْفَ يَلْقَوْنَ غَيًّا) **- əlbəttə,** (qiyamət günündə etdikləri şər və günahların) **cəzasını çəkib əzaba düçar olacaqlar.**

**60)** (اِلَّا مَنْ تَابَ وَاٰمَنَ وَعَمِلَ صَالِحًا) – (fasiq və asi şəxslərin hamısı qiyamət günündə öz əməllərinin cəzasına çatacaq). **Ancaq tövbə edib Allah-Təalaya iman gətirib yaxşı və gözəl əməl edənlər istisnadır,** (فَاُولٰٓئِكَ يَدْخُلُونَ الْجَنَّةَ وَلَا يُظْلَمُونَ شَيْـًٔا) **- belə şəxslər cənnətə daxil olub onlara heç bir zülm olunmayıb** (əməllərinin mükafatı əskiltilməz).

**61)** (جَنَّاتِ عَدْنٍ الَّتِي وَعَدَ الرَّحْمٰنُ عِبَادَهُ بِالْغَيْبِ) – (tövbə edənlərin daxil olduğu yer) **əbədi Ədn cənnətləridir ki, Rəhman olan Allah-Təala onu qaibanə şəkildə bəndələrinə vəd edib,** (onlar onu görməyiblər, yəni dünyada gördüklərinin oxşarı deyil). (اِنَّهُ كَانَ وَعْدُهُ مَأْتِيًّا) **- həqiqətən, Allah-Təalanın vədi haqdır,** (dərhal yerinə yetib, cənnətə gedib daxil olacaqlar).

**62)** (لَا يَسْمَعُونَ فِيهَا لَغْوًا اِلَّا سَلَامًا) – (o cənnətdə) **salamdan** (bir-birilərinə Allah-Təalanın rəhmətini göndərib, gözəl rəftar etməkdən) **başqa, heç bir boş, mənasız sözlər eşitməzlər.** (وَلَهُمْ رِزْقُهُمْ فِيهَا بُكْرَةً وَعَشِيًّا) **– ruziləri səhər-axşam ha-**

تِلْكَ الْجَنَّةُ الَّتِي نُورِثُ مِنْ عِبَادِنَا مَنْ كَانَ تَقِيًّا ﴿٦٣﴾ وَمَا نَتَنَزَّلُ اِلَّا بِاَمْرِ رَبِّكَۚ لَهُ مَا بَيْنَ اَيْدِينَا
وَمَا خَلْفَنَا وَمَا بَيْنَ ذٰلِكَۚ وَمَا كَانَ رَبُّكَ نَسِيًّاۚ ﴿٦٤﴾ رَبُّ السَّمٰوَاتِ وَالْاَرْضِ وَمَا بَيْنَهُمَا فَاعْبُدْهُ
وَاصْطَبِرْ لِعِبَادَتِهٖ هَلْ تَعْلَمُ لَهُ سَمِيًّاۚ ﴿٦٥﴾ وَيَقُولُ الْاِنْسَانُ ءَاِذَا مَا مِتُّ لَسَوْفَ اُخْرَجُ حَيًّا ﴿٦٦﴾
اَوَلَا يَذْكُرُ الْاِنْسَانُ اَنَّا خَلَقْنَاهُ مِنْ قَبْلُ وَلَمْ يَكُ شَيْـًٔا ﴿٦٧﴾ فَوَرَبِّكَ لَنَحْشُرَنَّهُمْ وَالشَّيَاطِينَ

---

**zırlanar** (necə ki dünyada səhər-axşam ruzi tədarük edirlər. Hərçənd axirətdə gün deyə bir şey olmadığından səhər və axşam vaxtı da olmaz. Amma Allah-Təala insanlara dünyadakı adətləri üzrə xəbər verir ki, ruzi dərdi çəkməsinlər)**.**

**63)** (تِلْكَ الْجَنَّةُ الَّتِي نُورِثُ مِنْ عِبَادِنَا مَنْ كَانَ تَقِيًّا) **-** (necə ki dünyada bir şəxs miras sahibi olanda başqası ondan o malı ala bilməzsə, habelə) **bu cənnət də elə bir yerdir ki, axirətdə bəndələrimizdən müttəqi olan şəxslərə onu miras verib** (onlara məxsus edərik, heç vaxt onlardan alınmaz)**.**

**64)** (وَمَا نَتَنَزَّلُ اِلَّا بِاَمْرِ رَبِّكَ) **-** (Cəbrayıl bir müddət Hz. Peyğəmbərə gəlməyib, ona ehkam gətirmədi, bir müddətdən sonra gəldikdə isə, Hz. Peyğəmbər onun gecikməsindən şikayət etdi. Allah-Təala Cəbrayılın dili ilə ona cavab verib buyurur: ey Məhəmməd)**, bizim enib** (Allah-Təala tərəfindən vəhy gətirməmiz) **ancaq sənin rəbbin Allah-Təalanın əmriylədir,** (Allah-Təala nə vaxt əmr etsə, o vaxt da gəlib vəhyi sənə çatdırarıq)**.** (لَهُ مَا بَيْنَ اَيْدِينَا وَمَا خَلْفَنَا وَمَا بَيْنَ ذٰلِكَ) **-** (ey Məhəmməd)**, önümüzdə və arxamızda və onların arasında nə varsa,** (Allah-Təalanın ixtiyarında olub) **Ona məxsusdur,** (Ondan icazəsiz ixtiyarımız yoxdur)**.** (وَمَا كَانَ رَبُّكَ نَسِيًّا) **-** (ey Məhəmməd)**, sənin rəbbin Allah-Təala** (səni tərk edib) **unudan deyil.** (Ancaq məsləhətə görə, vəhy göndərir)**.**

**65)** (رَبُّ السَّمٰوَاتِ وَالْاَرْضِ وَمَا بَيْنَهُمَا) **-** (ey Məhəmməd)**, sənin rəbbin Allah-Təala səmaların və yerin, onların arasında olan şeylərin rəbbi, tərbiyə verənidir.** (فَاعْبُدْهُ وَاصْطَبِرْ لِعِبَادَتِهٖ) **–** (vəhyin gecikməsinə görə üzülmə)**, Allah-Təalaya ibadət edib onun ibadətində səbir et,** (sabitqədəm ol)**.** (هَلْ تَعْلَمُ لَهُ سَمِيًّا) **-** (ey Məhəmməd)**, bəs Allah-Təaladan başqa onunla adaş olan,** (məbud olmaqda ona şərik olan birini) **bilirsən?** (Əlbəttə, yoxdur, Allah elə bir müqəddəs zatın adıdır ki, onun ikincisi yoxdur)**.**

**66)** (وَيَقُولُ الْاِنْسَانُ ءَاِذَا مَا مِتُّ لَسَوْفَ اُخْرَجُ حَيًّا) **-** (ey Məhəmməd, insan qiyaməti inkar edib) **deyir: "Mən öldükdən sonra** (dirildilib qəbirdən) **diri çıxacağam?** (Heç vaxt belə şey olmaz)**.**

**67)** (اَوَلَا يَذْكُرُ الْاِنْسَانُ اَنَّا خَلَقْنَاهُ مِنْ قَبْلُ وَلَمْ يَكُ شَيْـًٔا) **– bəs insan** (fikirləşib) **yadına salmır ki, həqiqətən, bundan qabaq o, heç bir şey ikən biz onu yaratdıq?**

**68)** (فَوَرَبِّكَ لَنَحْشُرَنَّهُمْ وَالشَّيَاطِينَ) **-** (ey Məhəmməd)**, and olsun sənin rəbbin Allah-Təalaya,** (qiyamət gününü inkar edənlərin hamısını və onları asi edib

ثُمَّ لَنُحْضِرَنَّهُمْ حَوْلَ جَهَنَّمَ جِثِيًّاۚ ﴿٦٨﴾ ثُمَّ لَنَنْزِعَنَّ مِنْ كُلِّ شِيعَةٍ اَيُّهُمْ اَشَدُّ عَلَى الرَّحْمٰنِ عِتِيًّاۚ
﴿٦٩﴾ ثُمَّ لَنَحْنُ اَعْلَمُ بِالَّذٖينَ هُمْ اَوْلٰى بِهَا صِلِيًّا ﴿٧٠﴾ وَاِنْ مِنْكُمْ اِلَّا وَارِدُهَاۚ كَانَ عَلٰى رَبِّكَ
حَتْمًا مَقْضِيًّاۚ ﴿٧١﴾ ثُمَّ نُنَجِّي الَّذٖينَ اتَّقَوْا وَنَذَرُ الظَّالِمٖينَ فٖيهَا جِثِيًّا ﴿٧٢﴾ وَاِذَا تُتْلٰى عَلَيْهِمْ اٰيَاتُنَا
بَيِّنَاتٍ قَالَ الَّذٖينَ كَفَرُوا لِلَّذٖينَ اٰمَنُوٓاۙ اَيُّ الْفَرٖيقَيْنِ خَيْرٌ مَقَامًا وَاَحْسَنُ نَدِيًّا ﴿٧٣﴾ وَكَمْ اَهْلَكْنَا قَبْلَهُمْ
مِنْ قَرْنٍ هُمْ اَحْسَنُ اَثَاثًا وَرِءْيًا ﴿٧٤﴾

---

yoldan çıxaran) **şeytanlarla** (insan şeytanları ilə) **bir yerdə məhşərdə toplayarıq.** (ثُمَّ لَنُحْضِرَنَّهُمْ حَوْلَ جَهَنَّمَ جِثِيًّا) **- ondan sonra onların hamısını** (cəhənnəm qorxusundan) **dizləri üstündə çökmüş halda cəhənnəmin ətrafında hazır edərik.**

**69)** (ثُمَّ لَنَنْزِعَنَّ مِنْ كُلِّ شِيعَةٍ اَيُّهُمْ اَشَدُّ عَلَى الرَّحْمٰنِ عِتِيًّا) – (cəhənnəmin ətrafında onları toplayandan) **sonra hər bir dəstədən Allah-Təalaya ən çox asi** (və kafir) **olanları dartıb çıxarıb,** (cəhənnəmə salacağıq, ondan sonra yerdə qalanları asilikdəki dərəcələrinə görə, dalbadal cəhənnəmə daxil edəcəyik)**.**

**70)** (ثُمَّ لَنَحْنُ اَعْلَمُ بِالَّذٖينَ هُمْ اَوْلٰى بِهَا صِلِيًّا) **- ondan sonra** (məhşər əhlindən) **kimlərin cəhənnəmə daxil olmağa daha layiq olduğundan biz agahıq.**

**71)** (وَاِنْ مِنْكُمْ اِلَّا وَارِدُهَا كَانَ عَلٰى رَبِّكَ حَتْمًا مَقْضِيًّا) – **sizdən elə bir kəs olmaz ki,** (qiyamət günü cəhənnəmə) **daxil olub** (onun dəhşətini görməsin)**,** (necə ki bir karvan bir yerə varid olub onun kənarında dayananda o yerə baxıb onun halından agah olarlar, oraya daxil olan olar, daxil olmayan da qayıdıb öz yolu ilə gedər. Cəhənnəmə gedənlər də belədir. Bütün insanlar cəhənnəmin ətrafına yığılıb, onun halına, əzabına agah olarlar. Ey Məhəmməd)**, bu sənin rəbbin Allah-Təalanın özünə vacib etdiyi hökmdür** (ki, sizin hamınızı bu şəkildə cəhənnəmə varid etsin)**.**

**72)** (ثُمَّ نُنَجِّي الَّذٖينَ اتَّقَوْا وَنَذَرُ الظَّالِمٖينَ فٖيهَا جِثِيًّا) **- ondan sonra müttəqi şəxslərə** (oradan) **nicat verib** (behiştə apararıq)**. Zalımları da** (üzüüstə yıxılıb) **dizləri üstə çökmüş halda** (cəhənnəmin ətrafında) **qoyarıq.**

**73)** (وَاِذَا تُتْلٰى عَلَيْهِمْ اٰيَاتُنَا بَيِّنَاتٍ) - (ey Məhəmməd)**, bizim** (gözəl sözlü) **açıq-aşkar** (möcüzə olan mənalı) **ayələrimiz müşriklərə oxunanda,** (yəni ey Məhəmməd, sən oxuyanda)**,** (قَالَ الَّذٖينَ كَفَرُوا لِلَّذٖينَ اٰمَنُوا اَيُّ الْفَرٖيقَيْنِ خَيْرٌ مَقَامًا وَاَحْسَنُ نَدِيًّا) – (dünya həyatından başqa, bir şey bilməyən cahil) **kafirlər mömin şəxslərə dedilər ki, bu iki dəstənin** (kafirlərin, yoxsa möminlərin) **hansı birinin** (dünyadakı) **məqamı abad və məclisləri gözəldir?** (Hansının həyatı gözəldirsə, demək o, Allah-Təalaya yaxındır)**.**

**74)** (وَكَمْ اَهْلَكْنَا قَبْلَهُمْ مِنْ قَرْنٍ هُمْ اَحْسَنُ اَثَاثًا وَرِءْيًا) – (ey Məhəmməd, müşriklərə de ki, dünya malına, libaslarına və boy-buxunlarına aldanmasınlar)**. Onlardan**

قُلْ مَنْ كَانَ فِي الضَّلَالَةِ فَلْيَمْدُدْ لَهُ الرَّحْمٰنُ مَدًّاۚ حَتّٰى اِذَا رَاَوْا مَا يُوعَدُونَ اِمَّا الْعَذَابَ وَاِمَّا السَّاعَةَۜ
فَسَيَعْلَمُونَ مَنْ هُوَ شَرٌّ مَكَانًا وَاَضْعَفُ جُنْدًا ﴿٧٥﴾ وَيَزِيدُ اللّٰهُ الَّذِينَ اهْتَدَوْا هُدًىۜ وَالْبَاقِيَاتُ
الصَّالِحَاتُ خَيْرٌ عِنْدَ رَبِّكَ ثَوَابًا وَخَيْرٌ مَرَدًّا ﴿٧٦﴾ اَفَرَاَيْتَ الَّذِي كَفَرَ بِاٰيَاتِنَا وَقَالَ لَاُوتَيَنَّ مَالًا
وَوَلَدًاۜ ﴿٧٧﴾ اَطَّلَعَ الْغَيْبَ اَمِ اتَّخَذَ عِنْدَ الرَّحْمٰنِ عَهْدًاۙ ﴿٧٨﴾

---

**öncə də dünya malı,** (libas və) **surət baxımından daha gözəl olan necə nəsilləri məhv etmişik.**

**75)** (قُلْ مَنْ كَانَ فِي الضَّلَالَةِ فَلْيَمْدُدْ لَهُ الرَّحْمٰنُ مَدًّا) **-** (ey Məhəmməd, müşriklərə) **de ki, kim** (Allah-Təaladan kənar, şirk və) **zəlalətdə isə Allah-Təala ona bir müddət möhlət verib** (tüğyan içində qoyar)**.** (حَتّٰى اِذَا رَاَوْا مَا يُوعَدُونَ اِمَّا الْعَذَابَ وَاِمَّا السَّاعَةَ) – (müşriklər dedikləri sözlərlə həmişə fəxr edib, məğrur olduqlarından sözlərini geri götürməzlər)**. Belə ki, Allah-Təala tərəfindən onlara vəd edilən əzabı** (müsəlmanların bu dünyada onlara qalib gəlib zəlil etdiyini) **və ya qiyamət günü** (cəhənnəm əzabını) **gördükdə,** (فَسَيَعْلَمُونَ مَنْ هُوَ شَرٌّ مَكَانًا وَاَضْعَفُ جُنْدًا) **– bilərlər ki, hansı birinin** (möminlərin, yoxsa kafirlərin) **məkanı daha pis və yardım baxımından daha zəifdir.** (Müşriklərin sözlərinin müqabilində Allah-Təala belə buyurar)**.**

**76)** (وَيَزِيدُ اللّٰهُ الَّذِينَ اهْتَدَوْا هُدًى) **– Allah-Təala hidayət tapıb imana daxil olan şəxslərin hidayətini daha da artırıb** (imanlarında sabit və bərqərar edər)**.** (وَالْبَاقِيَاتُ الصَّالِحَاتُ خَيْرٌ عِنْدَ رَبِّكَ ثَوَابًا وَخَيْرٌ مَرَدًّا) **-** (ey Məhəmməd)**, əbədi qalan yaxşı əməllər isə rəbbin Allah-Təalanın yanında əcr və savab baxımından daha xeyirlidir, aqibət baxımından da yaxşıdır,** (cənnətlikdir. Peşman olan kafirlərin fəxr etdiyi şeylərin aqibəti isə fənadır)**.**

**77)** (اَفَرَاَيْتَ الَّذِي كَفَرَ بِاٰيَاتِنَا وَقَالَ لَاُوتَيَنَّ مَالًا وَوَلَدًا) **-** (müsəlmanlardan Xabbab ibn Ərət deyir: "Məkkədə müşriklərdən olan As ibn Vail Səhmi mənə borclu idi. Borcumu ondan tələb etdim. Dedi: "Məhəmmədi inkar etmədikcə, verməyərəm." Dedim: "And olsun Allah-Təalaya, nə həyatda, nə öldükdə, nə də təkrar dirilib məhşərə getdiyimdə Məhəmmədi inkar etmərəm." As dedi: "Mən öləndən sonra diriləcəyəm?" Dedim: "Bəli." Dedi: "Nə vaxt dirilsəm, orada mənim malım və övladlarım da olacaq, gələrsən orada borcunu qaytararam." (Buxari, Təfsiru surə, 19/3,4,6; Müslüm, Münafiqin 35) O vaxt da bu ayə nazil oldu, ayənin mənası belədir: "Ey Məhəmməd)**, ayələrimizi** (qiyaməti) **inkar edib və** (qiyamətdə dirilib gəlsəm, Allah-Təala) **mənə yaxşı mal və övlad verər,** (orada sənin borcunu qaytararam) **deyən adamı** (As ibn Vaili) **gördünmü?**

**78)** (اَطَّلَعَ الْغَيْبَ)**- yoxsa** (As) **qeybdən agahdır?** (Özünü cənnət əhli sayıb xatircəmliklə belə sözlər deyir?) (اَمِ اتَّخَذَ عِنْدَ الرَّحْمٰنِ عَهْدًا) **- yoxsa Allah-Təala**

كَلَّا سَنَكْتُبُ مَا يَقُولُ وَنَمُدُّ لَهُ مِنَ الْعَذَابِ مَدًّا ﴿٧٩﴾ وَنَرِثُهُ مَا يَقُولُ وَيَأْتِينَا فَرْدًا ﴿٨٠﴾ وَاتَّخَذُوا
مِنْ دُونِ اللّٰهِ اٰلِهَةً لِيَكُونُوا لَهُمْ عِزًّا ﴿٨١﴾ كَلَّا سَيَكْفُرُونَ بِعِبَادَتِهِمْ وَيَكُونُونَ عَلَيْهِمْ ضِدًّا ﴿٨٢﴾
اَلَمْ تَرَ اَنَّا اَرْسَلْنَا الشَّيَاطِينَ عَلَى الْكَافِرِينَ تَؤُزُّهُمْ اَزًّا ﴿٨٣﴾ فَلَا تَعْجَلْ عَلَيْهِمْ اِنَّمَا نَعُدُّ لَهُمْ عَدًّا
﴿٨٤﴾ يَوْمَ نَحْشُرُ الْمُتَّقِينَ اِلَى الرَّحْمٰنِ وَفْدًا ﴿٨٥﴾ وَنَسُوقُ الْمُجْرِمِينَ اِلٰى جَهَنَّمَ وِرْدًا ﴿٨٦﴾

---

**yanında** (möhkəm) **əhd alıbdır** (ki, gərək axirətdə ona cənnət, mal və övlad verilsin? Bunların hansı biri o kafir (As ibn Vaildən) ötrü var?)

**79)** (كَلَّا سَنَكْتُبُ مَا يَقُولُ) **- elə deyil,** (o kafir yalan deyir)**, əlbəttə, onun dediklərini yazıb** (saxlayırıq)**.** (وَنَمُدُّ لَهُ مِنَ الْعَذَابِ مَدًّا) **- əzabını da uzadıb artırarıq.**

**80)** (وَنَرِثُهُ مَا يَقُولُ وَيَأْتِينَا فَرْدًا) **-** (As ibn Vailin) **dediyi şeyləri** (qiyamət günündə malım, övladım olacaq) **ondan alıb,** (qiyamət günündə) **tək-tənha** (heç nəsiz və heç kimsəsiz bizim tərəfimizə) **gələr.**

**81)** (وَاتَّخَذُوا مِنْ دُونِ اللّٰهِ اٰلِهَةً لِيَكُونُوا لَهُمْ عِزًّا) – (müşriklər) **özlərinə Allah-Təaladan başqa məbudlar qəbul etdilər ki,** (qiyamət günü) **onlara qüvvət** (və kömək) **olub** (şəfaət etsinlər. Müşriklər bir neçə cür idilər, bəziləri qiyaməti inkar edir, bəziləri qəbul edirdilər. As ibn Vail isə inkar edənlərdən idi. Bu ayədə bəhs edilən müşriklər axirətə inananlardan idilər)**.**

**82)** (كَلَّا سَيَكْفُرُونَ بِعِبَادَتِهِمْ) – **xeyr,** (müşriklərin güman etdiyi kimi Allah-Təaladan başqa məbudlar onlara kömək olub, şəfaət etməyəcəklər, bəlkə, qiyamət günü o məbudlar) **onların ibadətini inkar edərlər.** (وَيَكُونُونَ عَلَيْهِمْ ضِدًّا) – (kömək etmə əvəzinə) **onlara zidd olub** (təkfir və lənət edərlər)**.**

**83)** (اَلَمْ تَرَ اَنَّا اَرْسَلْنَا الشَّيَاطِينَ عَلَى الْكَافِرِينَ تَؤُزُّهُمْ اَزًّا) – (ey Məhəmməd)**, bəs baxıb görmürsən ki, həqiqətən, biz şeytanları kafirlərə öz əmədləri səbəbinə düçar etmişik. Onları** (Allah-Təalaya) **itaətsizliyə sövq edib** (asi edərlər)**.**

**84)** (فَلَا تَعْجَلْ عَلَيْهِمْ اِنَّمَا نَعُدُّ لَهُمْ عَدًّا) - (ey Məhəmməd, onların şərindən xilas olmaq üçün müşriklərə) **əzab istəməkdə tələsmə. Həqiqətən, biz onların** (günlərini) **bir-bir sayırıq.** (Onlara vəd edilən gün gəldikdə hamısı həlak olub, siz də onların şər və fəsadlarından xilas olarsınız)**.**

**85)** (يَوْمَ نَحْشُرُ الْمُتَّقِينَ اِلَى الرَّحْمٰنِ وَفْدًا) - (ey Məhəmməd, xalqa de ki, qiyamət) **günü müttəqiləri izzət və ehtiramla Rəhman olan Allahın hüzuruna toplayarıq.** (Necə ki dünyada möhtərəm şəxslər padşahın hüzuruna varid olanda onlara hörmət edilər. Allah-Təalanın hüzuruna gedən möminlərlə belədir)**.**

**86)** (وَنَسُوقُ الْمُجْرِمِينَ اِلٰى جَهَنَّمَ وِرْدًا) **- biz** (kafir və) **günahkarları da** (son dərəcə zillətlə) **susuz olduqları halda, cəhənnəmə sürükləyib gətirərik.**

لَا يَمْلِكُونَ الشَّفَاعَةَ اِلَّا مَنِ اتَّخَذَ عِنْدَ الرَّحْمٰنِ عَهْدًاۢ ﴿٨٧﴾ وَقَالُوا اتَّخَذَ الرَّحْمٰنُ وَلَدًاۜ ﴿٨٨﴾
لَقَدْ جِئْتُمْ شَيْـًٔا اِدًّاۙ ﴿٨٩﴾ تَكَادُ السَّمٰوَاتُ يَتَفَطَّرْنَ مِنْهُ وَتَنْشَقُّ الْاَرْضُ وَتَخِرُّ الْجِبَالُ هَدًّاۙ ﴿٩٠﴾
اَنْ دَعَوْا لِلرَّحْمٰنِ وَلَدًاۚ ﴿٩١﴾ وَمَا يَنْبَغِي لِلرَّحْمٰنِ اَنْ يَتَّخِذَ وَلَدًاۜ ﴿٩٢﴾ اِنْ كُلُّ مَنْ فِي السَّمٰوَاتِ
وَالْاَرْضِ اِلَّٓا اٰتِي الرَّحْمٰنِ عَبْدًاۜ ﴿٩٣﴾ لَقَدْ اَحْصٰيهُمْ وَعَدَّهُمْ عَدًّاۜ ﴿٩٤﴾ وَكُلُّهُمْ اٰتِيهِ يَوْمَ الْقِيٰمَةِ
فَرْدًا ﴿٩٥﴾ اِنَّ الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ سَيَجْعَلُ لَهُمُ الرَّحْمٰنُ وُدًّا ﴿٩٦﴾

---

**87)** (لَا يَمْلِكُونَ الشَّفَاعَةَ اِلَّا مَنِ اتَّخَذَ عِنْدَ الرَّحْمٰنِ عَهْدًا) – (imanı səbəbilə) **Allah-Təala dərgahından** (möhkəm) **əhd alandan başqası** (qiyamət günü) **şəfaət etməyə qadir olmaz.** (Ancaq mömin və müvəhhidlərdən ötrü şəfaət vardır)**.**

**88)** (وَقَالُوا اتَّخَذَ الرَّحْمٰنُ وَلَدًا) - (ey Məhəmməd, camaat) **deyir ki, Allah-Təala özünə övlad götürübdür,** (müşriklər mələkləri Allah-Təalanın qızı, xristianlar İsanı, yəhudilər Üzeyiri Allah-Təalanın oğlu sayırdılar)**.**

**89)** (لَقَدْ جِئْتُمْ شَيْـًٔا اِدًّا) - **həqiqətən, çox böyük-böyük danışıb** (təəccüblü, pis söz deyirsiniz)**.**

**90-91)** (تَكَادُ السَّمٰوَاتُ يَتَفَطَّرْنَ مِنْهُ) – (bu söz - Allah-Təalaya övlad isnad etmək elə böyük bir sözdür ki, bu sözün çirkinliyindən) **az qaldı səmalar parçalansın.** (وَتَنْشَقُّ الْاَرْضُ) - **və yer də parçalanıb** (əhalisi yerə qərq olsun)**.** (وَتَخِرُّ الْجِبَالُ هَدًّا اَنْ دَعَوْا لِلرَّحْمٰنِ وَلَدًا) - **və dağlar yıxılıb parça-parça olsun. Çünki Allah-Təalaya övlad isnad edirlər.** (Allah-Təalaya övlad isnad etmək belə böyük qəbih işdir. Çünki övlad sahibi olmaq cismin xüsusiyyətidir. Allah-Təala cisim olmaqdan pak və müqəddəsdir)**.**

**92)** (وَمَا يَنْبَغِي لِلرَّحْمٰنِ اَنْ يَتَّخِذَ وَلَدًا) - **Allah-Təalaya layiq deyil ki, özünə övlad götürsün.**

**93)** (اِنْ كُلُّ مَنْ فِي السَّمٰوَاتِ وَالْاَرْضِ اِلَّا اٰتِي الرَّحْمٰنِ عَبْدًا) - **səmalarda və yerdə olan məxluqat** (qiyamət günü) **Allah-Təalanın hüzuruna** (qul kimi) **qorxu və təqva ilə gələrlər.**

**94)** (لَقَدْ اَحْصٰيهُمْ وَعَدَّهُمْ عَدًّا) - **həqiqətən, Allah-Təala** (məxluqların) **hamısının** (sayını, əməllərini) **hesablayıb** (mühafizə edər, heç bir şey onun qüdrətindən, itaətindən kənara çıxa bilməz)**.**

**95)** (وَكُلُّهُمْ اٰتِيهِ يَوْمَ الْقِيٰمَةِ فَرْدًا) - **qiyamət günündə hamısı Allah-Təalanın tərəfinə yalqız** (dünya malını tərk etmiş halda) **gələrlər.**

**96)** (اِنَّ الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ سَيَجْعَلُ لَهُمُ الرَّحْمٰنُ وُدًّا) - **həqiqətən o şəxslər ki iman gətirib gözəl əməllər edir, Allah-Təala onların qəlblərində məhəbbət yaradar.** (Allah-Təala və möminlər onları özlərinə dost sayarlar)**.**

فَاِنَّمَا يَسَّرْنَاهُ بِلِسَانِكَ لِتُبَشِّرَ بِهِ الْمُتَّقِينَ وَتُنْذِرَ بِهٖ قَوْمًا لُدًّا ﴿٩٧﴾ وَكَمْ اَهْلَكْنَا قَبْلَهُمْ مِنْ قَرْنٍ هَلْ تُحِسُّ مِنْهُمْ مِنْ اَحَدٍ اَوْ تَسْمَعُ لَهُمْ رِكْزًا ﴿٩٨﴾

---

**97)** (فَاِنَّمَا يَسَّرْنَاهُ بِلِسَانِكَ لِتُبَشِّرَ بِهِ الْمُتَّقِينَ وَتُنْذِرَ بِهٖ قَوْمًا لُدًّا) **-** (ey Məhəmməd)**, həqiqətən,** (bu Quranı) **sənin dilində asanlaşdırıb** (sənə təlim etdik ki,) **müttəqiləri onunla müjdələyib, şiddətli düşmənləri də onunla qorxudasan.**

**98)** (وَكَمْ اَهْلَكْنَا قَبْلَهُمْ مِنْ قَرْنٍ) **-** (ey Məhəmməd, müşriklərdən) **əvvəl neçə nəsil həlak etdik.** (هَلْ تُحِسُّ مِنْهُمْ مِنْ اَحَدٍ) **- heç onlardan birini də** (yer üzündə) **görürsən?** (اَوْ تَسْمَعُ لَهُمْ رِكْزًا) **- ya da onların gizlin səslərini eşidib hallarına agah olursan?** (Onların heç biri yoxdur. Habelə Qurana iman etməyən bu Qüreyş camaatının aqibəti də o qövmlər kimi olacaq)**.**

Allaha həmd olsun, Məryəm surəsinin təfsiri bitdi. Bu mübarək surədə Rəhman sözünün 16 dəfə təkrarlanmasında məqsəd Qüreyş camaatını rədd etməkdir. Çünki Qüreyş camaatı Rəhman adının Allah-Təalaya aid edilməsini caiz görməyib, belə deyirdilər: “Biz Rəhmanın nə olduğunu bilmirik.” Bu səbəbdən bu mübarək surədə Rəhman sözü təkrarlanıbdır. Hz. Peyğəmbər Məkkədə olanda onun Həbəşistana hicrət edən səhabələrindən biri Cəfər Əbu Talib oğlu idi. Cəfər bu surəni Həbəş padşahı Nəcaşinin hüzurunda oxudu. Nəcaşi və orada olanlar ağlayıb, mübarək surənin məzmununu təsdiq etdilər. Hz. Peyğəmbər buyurubdur: “Kim Məryəm surəsini oxusa, Allah-Təala ona 10 savab bəxş edər.” (Qazi, Beyzavi, IV/185)



## TA-HA SURƏSİ

20-ci surədir. Məkkədə nazil olub, 135 ayə, 1641 kəlmə, 5242 hərfdir.



بِسْمِ اللّٰهِ الرَّحْمٰنِ الرَّحِيمِ. طٰهٰ ﴿١﴾ مَآ اَنْزَلْنَا عَلَيْكَ الْقُرْاٰنَ لِتَشْقٰىۙ ﴿٢﴾ اِلَّا تَذْكِرَةً لِمَنْ يَخْشٰىۙ
﴿٣﴾ تَنْزِيلًا مِمَّنْ خَلَقَ الْاَرْضَ وَالسَّمٰوَاتِ الْعُلٰىؕ ﴿٤﴾ اَلرَّحْمٰنُ عَلَى الْعَرْشِ اسْتَوٰى ﴿٥﴾ لَهُ
مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِ وَمَا بَيْنَهُمَا وَمَا تَحْتَ الثَّرٰى ﴿٦﴾ وَاِنْ تَجْهَرْ بِالْقَوْلِ فَاِنَّهُ يَعْلَمُ
السِّرَّ وَاَخْفٰى ﴿٧﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1)** (طٰهٰ) **bu mübarək surənin adıdır.**

**2)** (مَا اَنْزَلْنَا عَلَيْكَ الْقُرْاٰنَ لِتَشْقٰى) - (ey Məhəmməd)**, biz sənə Quranı nazil etmədik ki,** (kaş kafir və müşriklər imana gəlsin deyə) **zəhmət və məşəqqət,** (həsrət) **çəkəsən.** (Sənin vəzifən ancaq təbliğ etməkdir. Onların işini isə bizə həvalə et)**.**

**3)** (اِلَّا تَذْكِرَةً لِمَنْ يَخْشٰى) **- bu Quran ancaq** (Allahdan) **qorxub** (iman edənlər üçün) **bir öyüd-nəsihətdir,** (nəinki asi və bədbəxt şəxslərdən ötrü, sən əbəs yerə özünü məşəqqətə salıb onları düşünmə)**.**

**4)** (تَنْزِيلًا مِمَّنْ خَلَقَ الْاَرْضَ وَالسَّمٰوَاتِ الْعُلٰى) – (bu Quran sənə) **yeri və uca səmaları yaradan** (uca məqam sahibi Allah) **tərəfindən nazil olubdur.**

**5)** (اَلرَّحْمٰنُ عَلَى الْعَرْشِ اسْتَوٰى) – (səmaları və yeri yaradan) **Rəhman olan Allah-Təala bütün aləmlərə hakim olub,** (heç bir şey onun qüdrətindən kənar ola bilməz)**.**

**6)** (لَهُ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِ وَمَا بَيْنَهُمَا وَمَا تَحْتَ الثَّرٰى) **- səmalarda, yerdə və onların arasında və torpağın altında nə varsa, hamısı Allah-Təalanındır** (Onun ixtiyarındadır)**.**

**7)** (وَاِنْ تَجْهَرْ بِالْقَوْلِ فَاِنَّهُ يَعْلَمُ السِّرَّ وَاَخْفٰى) - (ey Məhəmməd)**, əgər sən uca səslə Allah-Təalaya dua etsən də,** (bunu bil ki, Allah-Təalanın buna ehtiyacı yoxdur, bəlkə, gizlin dua etmək daha yaxşıdır)**, həqiqətən, Allah-Təala gizlin** (danışıqları da) **və ondan da gizlin olan** (qəlblərdə olub hələ aşkar edilməyən sözlərə də) **agahdır.**

**اَللّٰهُ لَٓا اِلٰهَ اِلَّا هُوَۜ لَهُ الْاَسْمَٓاءُ الْحُسْنٰى ﴿٨﴾ وَهَلْ اَتٰيكَ حَد۪يثُ مُوسٰىۢ ﴿٩﴾ اِذْ رَاٰ نَارًا فَقَالَ لِاَهْلِهِ امْكُثُٓوا اِنّ۪ٓي اٰنَسْتُ نَارًا لَعَلّ۪ٓي اٰت۪يكُمْ مِنْهَا بِقَبَسٍ اَوْ اَجِدُ عَلَى النَّارِ هُدًى ﴿١٠﴾ فَلَمَّٓا اَتٰيهَا نُودِيَ يَا مُوسٰى ﴿١١﴾ اِنّ۪ٓي اَنَا۬ رَبُّكَ**

---

**8)** (اَللّٰهُ لَٓا اِلٰهَ اِلَّا هُوَۜ لَهُ الْاَسْمَٓاءُ الْحُسْنٰى) – (haqq məbud yeganə olan) **Allah-Təaladır. Ondan başqa haqq məbud yoxdur. Ən yaxşı və gözəl adlar Ona məxsusdur,** (o adlar Allah-Təalanın əzəmət və müqəddəsliyinə işarədir. Bundan sonra Allah-Təala Hz. Musanın qissəsini Hz. Məhəmmədə (ə.s), bəyan edir. Belə ki, vəhyi təbliğ etməkdə və xalqın əziyyətlərinə səbir etməkdə Musa kimi olub təbliğ işində möhkəm olsun. Necə ki Hz. Peyğəmbər insanlar tərəfindən çox incidiləndə belə demişdi: "Allah-Təala qardaşım Musaya rəhmət etsin. Məndən artıq ona əziyyət etdilər, səbir etdi." (Buxari, Enbiya 28; Müslüm, Zəkat 14, 141; Əhməd b. Hənbel, Müsnəd, I/38, 396, 411, 441) Musanın qissəsi buradakı kimi heç bir surədə belə təfsilatı ilə bəyan olunmayıbdır)**.**

**9)** (وَهَلْ اَتٰيكَ حَد۪يثُ مُوسٰى) **-** (ey Məhəmməd)**, Musanın qissəsi gəlib sənə çatıbmı?** (Bəlkə də, çatmayıbdır. Gərək, sənə bəyan edək)**.**

**10)** (اِذْ رَاٰ نَارًا) **-** (ey Məhəmməd, yadına salıb xalqa de: "Musa Mədyən vilayətində Şüeybin yanından ayrılıb ailəsi ilə Misirə gələndə yol əsnasında ona od lazım oldu. Uzaqdan) **bir od gördükdə,** (فَقَالَ لِاَهْلِهِ امْكُثُٓوا اِنّ۪ٓي اٰنَسْتُ نَارًا) – **ailəsinə dedi: "**(burada) **durun, həqiqətən, mən od görürəm,** (bizə də od lazımdır)**.** (لَعَلّ۪ٓي اٰت۪يكُمْ مِنْهَا بِقَبَسٍ) **- əgər mümkün olsa, sizin üçün ondan bir parça köz gətirim.** (اَوْ اَجِدُ عَلَى النَّارِ هُدًى) **- ya da** (mümkün olmasa)**, bəlkə** (oradan) **odun gətirmək üçün bir bələdçi tapım** (ki, bəlkə, onların vasitəsilə od gətirim." O gecə qaranlıq, yağışlı bir gecə idi, Musanın arvadı Səfurəni doğuş sancısı tutub ona od lazım oldu. Çaxmaq daşını bir-birinə vursa da, ondan od hasil olmadı. O tərəfə, bu tərəfə baxıb uzaqdan od gördü)**.**

**11)** (فَلَمَّٓا اَتٰيهَا) – (Musa) **oda yaxınlaşdıqda,** (baxıb gördü ki, təzə bir ağac başdan ayağa atəş içindədir. Nə od ağacı yandırır, nə də ağac odu söndürür, son dərəcə ağ və işıqlı şimşək işığı kimi bir oddur. O ağacdan od götürə bilmədi. Çaşqın qalıb o işığa təəccüblə baxdı)**.** (نُودِيَ يَا مُوسٰى) – (ağacdan səs gəlib)**, deyildi: "ey Musa!**

**12)** (اِنّ۪ٓي اَنَا۬ رَبُّكَ) **- həqiqətən, mən sənin rəbbin Allah-Təalayam.** (Musa bu kəlamı eşidən kimi, çaşıb fikirləşdi ki, görəsən, bu səs, həqiqətən, Allah-Təaladandır, yoxsa şeytandandır. Sonra o ağaca və işığa diqqətlə baxıb onun Allah-Təaladan olduğunu anladı. Hər bir peyğəmbərə peyğəmbərlikdən əvvəl belə şeylər görünsə, ona "irhasat" (xariqüladə hal, yəni peyğəmbərliyin müqəddiməsi) deyilir, belə ki, peyğəmbər belə əlamət görəndə bilsin ki, ondan

فَاخْلَعْ نَعْلَيْكَۚ اِنَّكَ بِالْوَادِ الْمُقَدَّسِ طُوًىۜ ﴿١٢﴾ وَاَنَا اخْتَرْتُكَ فَاسْتَمِعْ لِمَا يُوحٰى ﴿١٣﴾ اِنَّن۪ٓي
اَنَا اللّٰهُ لَٓا اِلٰهَ اِلَّٓا اَنَا فَاعْبُدْن۪يۙ وَاَقِمِ الصَّلٰوةَ لِذِكْر۪ي ﴿١٤﴾ اِنَّ السَّاعَةَ اٰتِيَةٌ اَكَادُ اُخْف۪يهَا لِتُجْزٰى كُلُّ
نَفْسٍ بِمَا تَسْعٰى ﴿١٥﴾

---

sonra gələn xəbərlərin hamısı doğrudan da Allah-Təaladandır. Həllac Mənsur Ənəl-Həqq dediyinə görə, Bağdadda üləmalar toplanıb onun qətlinə fitva verdilər. Şeyx Şəbüstəri (Allah ona rəhmət etsin) bu barədə "Gülşəni-Raz" əsərində gözəl şeir deyib: "Bir ağacdan "mən Haqqam" deyilməsi doğrudur da, niyə xoşbəxt birindən olmasın?") (فَاخْلَعْ نَعْلَيْكَ اِنَّكَ بِالْوَادِ الْمُقَدَّسِ طُوًى) – (ey Musa), **başmaqlarını çıxar, həqiqətən, sən müqəddəs** (pak və pakizə) **Tuba vadisindəsən,** (orada başmaq geymək layiq deyil. Necə ki Məkkəyə gedəndə ehramda olub Beytullahı təvaf edəndə oranın müqəddəsliyindən ötrü ayaqqabıları çıxarmaq lazımdır, habelə müqəddəs Tuva vadisinin ehtiramına görə, Allah-Təala Musaya başmaqlarını çıxarmağı əmr etdi)**.**

**13)** (وَاَنَا اخْتَرْتُكَ فَاسْتَمِعْ لِمَا يُوحٰى) **-** (ey Musa)**, mən səni** (insanların arasından peyğəmbərlikdən ötrü) **seçdim. Sənə vəhy olunana qulaq as.**

**14)** (اِنَّن۪ي اَنَا اللّٰهُ لَٓا اِلٰهَ اِلَّٓا اَنَا فَاعْبُدْن۪ي وَاَقِمِ الصَّلٰوةَ لِذِكْر۪ي) – (ey Musa)**, həqiqətən mən** (haqq məbud olan) **Allah-Təalayam, məndən başqa haqq məbud yoxdur. Mənə ibadət edib, məni yad etmək üçün namazı*** (vaxtında) **qıl** (ki, qafil olmayasan)**.**

*(*__Qeyd:__ Allah-Təala hər bir peyğəmbərinə namazı tövsiyə edib tapşırıbdır. Ən çox da Qurani-Şərifdə Hz. Peyğəmbər vasitəsilə biz nadan, cahil müsəlmanlara tapşırıb, namazda Allah-Təalaya həmd-səna edilib, zikr edildiyindən bütün ibadətlərdən fəzilətli və mükəmməldir. Heyif! Bu dövrdə namaz qılan demək olar ki, az qalıbdır, namaz qılmaq hökmsüz bir şey kimi olub, az qalıb ki, yaddan çıxsın. Xüsusən, namazı camaatla bir yerdə qılmaq islamın ən birinci şüarı və tərəqqi səbəbi olduğundan Hz. peyğəmbər buyurubdur: "O şəxslər ki, namazı camaatla birlikdə qılmağı tərk edib, az qalıram ki, gedib onların evlərinə od vurub yandırım və xarab edim". İslam ümməti namazda olan böyük faydaları dərk etməyib, bu səbəbdən bu şəkildə namaz qılmağı tərk edib, onu əhəmiyyətsiz bir şey sayıblar. İmam kim olursa olsun, camaatla namaz qılındığı halda, gedib ayrı namaz qılanları Allah-Təala qiyamət günü sorğu-sual edəcəkdir. Camaatla namaz qılanlar Allah-Təalanın Qurani-Şərifdə vəsf etdiyi "məscidləri təmir edənlər" cərgəsində sayılırlar).*

**15)** (اِنَّ السَّاعَةَ اٰتِيَةٌ اَكَادُ اُخْف۪يهَا) – (ey Musa)**, həqiqətən, qiyamət günü gələcəkdir, az qalır ki, onu gizlədib** (vaxtını sizə xəbər verməyim. Əgər qiyamətin vaxtını gizlətməkdə fayda olmasaydı, heç vaxt sizə qiyamət haqqında xəbər verməzdim)**.** (لِتُجْزٰى كُلُّ نَفْسٍ بِمَا تَسْعٰى) – (qiyamət, əlbəttə, vaqe olacaq)**, ta ki, hər kəsə etdiyi** (xeyir, şər) **əməlin qarşılığı verilsin.**

فَلَا يَصُدَّنَّكَ عَنْهَا مَنْ لَا يُؤْمِنُ بِهَا وَاتَّبَعَ هَوٰيهُ فَتَرْدٰى ﴿١٦﴾ وَمَا تِلْكَ بِيَمِينِكَ يَا مُوسٰى ﴿١٧﴾
قَالَ هِيَ عَصَايَۚ اَتَوَكَّؤُا عَلَيْهَا وَاَهُشُّ بِهَا عَلٰى غَنَمِي وَلِيَ فِيهَا مَاٰرِبُ اُخْرٰى ﴿١٨﴾ قَالَ اَلْقِهَا يَا
مُوسٰى ﴿١٩﴾ فَاَلْقٰيهَا فَاِذَا هِيَ حَيَّةٌ تَسْعٰى ﴿٢٠﴾

---

**16)** (فَلَا يَصُدَّنَّكَ عَنْهَا مَنْ لَا يُؤْمِنُ بِهَا وَاتَّبَعَ هَوٰيهُ فَتَرْدٰى) - (ey Musa)**, nəfsinin istəklərinə tabe olub** (qiyamət gününə) **iman gətirməyənlərin çoxluğu sənin** (qiyaməti təsdiq etmənə) **mane olmasın**. (Onların çoxluğuna baxıb haqq olduqlarını zənn etmə. Sən dəlil və sübuta bax. Onlar nəfslərinə tabe olub həlak oldular)**, yoxsa sən də həlak olarsan.** (Buna iman etməkdə azlığın, çoxluğun dəyəri yoxdur, çünki etibarlı dəlildir, ola bilər ki, bir çox insanın etiqad etdiyi şey batil olsun, necə ki hər bir zamanda belə olubdur. Bu ayədə dəlilə tabe olub, dəlil üzrə əməl etməyə təşviq etməkdə məqsəd təqlidlə əməl etməyi qadağan edib qorxutmaqdır)**.**

**17)** (وَمَا تِلْكَ بِيَمِينِكَ يَا مُوسٰى) – (zikr olunan hökmləri Musaya təlim edəndən sonra peyğəmbərliyə işarə edən möcüzəni Musaya bəyan etməkdən ötrü Musadan soruşur:) **ey Musa, sağ əlindəki nədir?**

**18)** (قَالَ هِيَ عَصَايَ اَتَوَكَّؤُا عَلَيْهَا) - (Musa) **dedi: "**(ey mənim rəbbim)**, bu mənim əsamdır,** (yol gedəndə və yorulub duranda) **ona söykənirəm.** (وَاَهُشُّ بِهَا عَلٰى غَنَمِي) **- bununla qoyunlarımdan ötrü** (ağaclardan yarpaq) **silkələyirəm.** (O əsanın başı çövkan kimi əyri olduğundan ağacdan asanlıqla yarpaq tökmək olurdu)**.** (وَلِيَ فِيهَا مَاٰرِبُ اُخْرٰى) **– onda mənim üçün başqa mənfəətlər də var."** (Hz. Musa bu sözü dedi ki, bəlkə, Allah-Təala o mənfəətləri də soruşub onunla daha çox danışsın. O da Allah-Təala ilə danışmaqdan ləzzət alsın, necə ki aşiq məşuqəsiylə çox danışıb ləzzət almaqdan ötrü lazım olmayan sözləri də deyər)**.**

**19)** ( قَالَ اَلْقِهَا يَا مُوسٰى) – (Allah-Təala) **buyurdu:** (ey Musa, əlindəki əsanı yerə) **at.**

**20)** (فَاَلْقٰيهَا فَاِذَا هِيَ حَيَّةٌ تَسْعٰى) **-** (Musa Allah-Təalanın əmriylə əsanı əlindən yerə) **atdı,** (qəfildən baxıb gördü ki,) **o bir ilan olub sürətlə sürünür.** (Əvvəlcə Allah-Təala Musadan soruşdu ki, bu sağ əlindəki nədir? Bu sualdan məqsədi o idi ki, Musa əlindəki ağacın həqiqətini dərk edib, ondan sonra o ağac əjdəha olanda, bilsin ki, ağac əjdəha olmaz. Ancaq Allah-Təalanın kamil qüdrəti ilə bu mümkündür. Allah-Təala əsanın əjdəha olduğunu 3 məqamda 3 sözlə yad edir. Birincisi – Həyyə, yəni ilan (əjdəha da onun bir növüdür), ikincisi - Cann, yəni sürətlə sürünən ilan, 3-cüsü Su`ban, yəni ən böyük ilan, buna əjdəha deyilir. Əsanın ilan olmasını üç kəlmə ilə yad etməkdə səbəb odur ki, o əsa ilan olanda onda 3 xüsusiyyət olurdu: əvvəla ilan, sonra böyük

قَالَ خُذْهَا وَلَا تَخَفْ سَنُعِيدُهَا سِيرَتَهَا الْاُولٰى ﴿٢١﴾ وَاضْمُمْ يَدَكَ اِلٰى جَنَاحِكَ تَخْرُجْ بَيْضَٓاءَ مِنْ
غَيْرِ سُوٓءٍ اٰيَةً اُخْرٰىۙ ﴿٢٢﴾ لِنُرِيَكَ مِنْ اٰيَاتِنَا الْكُبْرٰىۚ ﴿٢٣﴾ اِذْهَبْ اِلٰى فِرْعَوْنَ اِنَّهُ طَغٰىۚ ﴿٢٤﴾

---

ilan - əjdəha, daha sonra da böyük və sürətli olan bir əjdəha. Hz. Musanın əsasının ilan olmasını Allah-Təalanın Quranda zikr etməsini bəyan etməklə kifayətlənib, onun həqiqətini izah etməkdən vaz keçdik).

**21)** (قَالَ خُذْهَا وَلَا تَخَفْ سَنُعِيدُهَا سِيرَتَهَا الْاُولٰى) – (Musa öz əsasını o şəkildə görəndə, onu qorxu bürüyüb qaçmağa başladı, Allah-Təaladan ona xitab gəlib) **buyurdu:** (ey Musa)**, tut onu qorxma, əlbəttə, biz onu əvvəlki halına qaytarıb** (əsa edəcəyik)**.** (Musa Allah-Təalanın fərmanından sonra qorxu içində əlini uzadıb onun çənəsindən tutub baxdı. Gördü ki, əlindəki elə həmin əsadır)**.**

**22)** (وَاضْمُمْ يَدَكَ اِلٰى جَنَاحِكَ تَخْرُجْ بَيْضَٓاءَ مِنْ غَيْرِ سُٓوءٍ اٰيَةً اُخْرٰى) – (ey Musa)**, əlini qoltuğuna sal ki, o da** (sənin doğruluğuna) **başqa bir dəlil olaraq qüsursuz* və ağappaq olaraq çıxsın.** (Musa Allah-Təalanın izniylə əlini qoltuğuna salıb çıxaranda əli şimşək kimi parlayıb çöl ondan işıqlandı)**.**

*(*__Qeyd:__ Qüsursuz sözü bu ağlığın baras (abraş) xəstəliyinə, ala çıxartmağa aid olmadığına işarədir. Yəni sənin əlin gecəni işıqlandıran şimşək kimi ağappaq olar, nəinki baras xəstəliyi kimi. Ərəblər baras xəstəliyindən iyrənib, onun adını da eşitməkdən çəkinirdilər. Hirə padşahı Cüzeymə baras xəstəliyinə tutulduğundan ərəblər onun adını deməkdən çəkinib, baras əvəzinə abraş deyib, onu Cüzeymətül-Abraş adlandırdılar. Bu Cüzeyməyə ərəblər sahibi-Ziba da deyirdilər. Ziba Şamda səltənət sahibi olan bir qadındır. Onunla Cüzeymənin arasında keçən əhvalatlar və öldürülməsi tarix kitablarında təfsilatı ilə qeyd olunubdur. Hz. Peyğəmbər bir qadınla evlənmişdi. Onunla yaxın olanda onun dizindən yuxarıda bir qədər baras əlaməti gördü, iyrəndiyindən az sonra onu boşadı).*

**23)** (لِنُرِيَكَ مِنْ اٰيَاتِنَا الْكُبْرٰى) – (ey Musa, sənə əsa ilə ağ əl möcüzəsini verməmizin səbəbi) **böyük olan möcüzələrimizdən** (bir qismini) **sənə göstərmək üçün idi.** (Yəni bu iki möcüzə bizim böyük möcüzələrimizdəndir, sənə göstəririk)**.**

**24)** (اِذْهَبْ اِلٰى فِرْعَوْنَ اِنَّهُ طَغٰى) – (ey Musa)**, indi bu möcüzələrlə** (Misirə)**, fironun yanına gedib** (onu dəvət et)**, həqiqətən, firon tüğyan edib** (Allah-Təalaya asi olmaqda həddi aşıbdır)**.** (Allah-Təala Musaya asi fironun yanına gedib onu tövhidə dəvət etməyi əmr etdikdə, Musa bildi ki, bu iş çox təhlükəli bir işdir. Ona möhkəm qəlbli, hər bir bəla və müsibətə səbir edə biləndən başqası dözməz. Bu səbəbdən Allah-Təaladan xahiş etdi ki, onun köksünü və dilini açıb, ruhuna genişlik verib onu həlim və səbirli etsin. Necə ki Allah-Təala ayədə xəbər verir)**.**

قَالَ رَبِّ اشْرَحْ لِي صَدْرِيۙ ﴿٢٥﴾ وَيَسِّرْ لِيٓ اَمْرِيۙ ﴿٢٦﴾ وَاحْلُلْ عُقْدَةً مِنْ لِسَانِيۙ ﴿٢٧﴾ يَفْقَهُوا
قَوْلِيۖ ﴿٢٨﴾ وَاجْعَلْ لِي وَزِيرًا مِنْ اَهْلِيۙ ﴿٢٩﴾ هٰرُونَ اَخِيۙ ﴿٣٠﴾ اُشْدُدْ بِهٖٓ اَزْرِيۙ ﴿٣١﴾
وَاَشْرِكْهُ فِيٓ اَمْرِيۙ ﴿٣٢﴾ كَيْ نُسَبِّحَكَ كَثِيرًاۙ ﴿٣٣﴾ وَنَذْكُرَكَ كَثِيرًاۜ ﴿٣٤﴾ اِنَّكَ كُنْتَ بِنَا بَصِيرًا
﴿٣٥﴾ قَالَ قَدْ اُوتِيتَ سُؤْلَكَ يَا مُوسٰى ﴿٣٦﴾ وَلَقَدْ مَنَنَّا عَلَيْكَ مَرَّةً اُخْرٰىۙ ﴿٣٧﴾ اِذْ اَوْحَيْنَٓا اِلٰٓى
اُمِّكَ مَا يُوحٰىۙ ﴿٣٨﴾ اَنِ اقْذِفِيهِ فِي التَّابُوتِ فَاقْذِفِيهِ فِي الْيَمِّ

---

**25)** (قَالَ رَبِّ اشْرَحْ لِي صَدْرِي) – (Musa) **dedi: ey mənim rəbbim, köksümü açıb genişlik ver** (ki, sənin vəhyinə və firondan gələcək məşəqqətlərə dözüb səbir edim)**.**

**26)** (وَيَسِّرْ لِيٓ اَمْرِي) – (vəhyi firona təbliğ etmə) **işimi asanlaşdır.**

**27-28)** (وَاحْلُلْ عُقْدَةً مِنْ لِسَانِي يَفْقَهُوا قَوْلِي) **-** (danışmama mane olan) **dilimdəki düyünü** (pəltəkliyi) **aç ki, sözlərimi yaxşı dərk edib anlasınlar.** (Musanın dilində pəltəklik olduğundan Allah-Təaladan onun düzəldilməsini xahiş etdi. Hz. Hüseynin dilində də pəltəklik var idi. Hz. Peyğəmbər buyurubdur: "Bu pəltəklik mənim oğluma əmisi Musadan miras qalıbdır")**.**

**29-32)** (وَاجْعَلْ لِي وَزِيرًا مِنْ اَهْلِي هٰرُونَ اَخِي اُشْدُدْ بِهٖٓ اَزْرِي وَاَشْرِكْهُ فِيٓ اَمْرِي) – (ey mənim rəbbim)**, mənə öz ailəmdən qardaşım Harunu mənə vəzir** (köməkçi) **et, onun səbəbinə qüvvətimi möhkəm et,** (peyğəmbərlik) **işimdə onu mənə şərik et.**

**33-34)** (كَيْ نُسَبِّحَكَ كَثِيرًا وَنَذْكُرَكَ كَثِيرًا) **- ta ki** (bir-birimizə kömək olub) **Səni çox təqdis edib, çox zikr edək** (və çox namaz qılıb ibadət edək)**.**

**35)** (اِنَّكَ كُنْتَ بِنَا بَصِيرًا) – (ey mənim rəbbim, Harunun mənə yaxşı köməkçi olacağını və bu səbəbdən işimizin asan olacağını və hər halımızı) **həqiqətən, sən özün görürsən.**

**36)** (قَالَ قَدْ اُوتِيتَ سُؤْلَكَ يَا مُوسٰى) – (Allah-Təala) **buyurdu: "Ey Musa, dilə-diyin sənə verildi.**

**37)** (وَلَقَدْ مَنَنَّا عَلَيْكَ مَرَّةً اُخْرٰى) **-** (ey Musa)**, həqiqətən, bir dəfə də sənə nemət bəxş etmişdik.**

**38)** (اِذْ اَوْحَيْنَٓا اِلٰٓى اُمِّكَ مَا يُوحٰى) **– o zaman ki vəhy edilməsi** (lazım olan) **şeyi anana vəhy edib bildirdik,** (Musanın anasına vəhy etmək, bal arısına vəhy etmək kimidir. Necə ki Nəhl surəsində qeyd olundu)**.**

**39)** (اَنِ اقْذِفِيهِ فِي التَّابُوتِ) – (ey Musa, anana vəhy olunan sözlər bunlardır, fi-ron uşaqları qətlə yetirəndə, səni mühafizə edib saxlamaqdan ötrü anana vəhy edib əmr etdik ki, Musanı) **bir sandığa qoy,** (فَاقْذِفِيهِ فِي الْيَمِّ) **- sonra onu** (Nil)

فَلْيُلْقِهِ الْيَمُّ بِالسَّاحِلِ يَأْخُذْهُ عَدُوٌّ لِي وَعَدُوٌّ لَهُ ۚ وَاَلْقَيْتُ عَلَيْكَ مَحَبَّةً مِنّ۪ي وَلِتُصْنَعَ عَلٰى عَيْن۪ي ﴿٣٩﴾ اِذْ تَمْش۪ٓي اُخْتُكَ فَتَقُولُ هَلْ اَدُلُّكُمْ عَلٰى مَنْ يَكْفُلُهُ فَرَجَعْنَاكَ اِلٰٓى اُمِّكَ كَيْ تَقَرَّ عَيْنُهَا وَلَا تَحْزَنَ وَقَتَلْتَ نَفْسًا فَنَجَّيْنَاكَ مِنَ الْغَمِّ وَفَتَنَّاكَ فُتُونًا

---

**çayına at.** (فَلْيُلْقِهِ الْيَمُّ بِالسَّاحِلِ) **- əlbəttə,** (Nil) **çayı Musanı sahilə çıxarar,** (يَأْخُذْهُ عَدُوٌّ لِي وَعَدُوٌّ لَهُ) **- mənim və onun** (Musanın) **düşməni olan** (firon o sandığı tutub Musanı oradan) **götürər.** (Musanın anası Allah-Təalanın vəhyiylə bir sandıq götürüb onun içini pambıq ilə döşəyib sandığın üstünə qır tökdü ki, onun içinə su daxil olmasın. Allah-Təalaya təvəkkül edib sandığı Nil çayına saldı. Nildən aralanıb fironun bağına daxil olan bir qol ilə sandıq bağa daxil oldu. Firon xanımı Asiya ilə bir barakın kənarında gəzərkən o sandığı görüb əmr etdi ki, sandığı sudan çıxarıb onun hüzuruna gətirsinlər. Sandığı açıb onun içində gözəl bir uşaq görəndə içində ona qarşı böyük bir məhəbbət oyandı və onun qorunmasını əmr etdi. Bundan sonra gələn ayədə Allah-Təala Musaya xitab edir ki, ey Musa, bax gör, öz düşmənin əlində səni yetişdirdim)**.** (وَاَلْقَيْتُ عَلَيْكَ مَحَبَّةً مِنّ۪ي) – (ey Musa)**, özümdən sənə bir məhəbbət verdim.** (O səbəbdən firon və onun adamları səni sevib mühafizə etdilər)**.** (وَلِتُصْنَعَ عَلٰى عَيْن۪ي) **- belə ki, gözümün önündə** (mənim nəzarətim, himayəm altında səni gözəl şəkildə qoruyub) **tərbiyə etsinlər.** (Musanı Nilə atandan sonra anasının qəlbi iztiraba düşüb bacısını onun dalınca Nilin sahilinə göndərdi. Belə ki, sandıqdan xəbəri olsun. Bacısı çayın sahili ilə sandığa baxa-baxa gedib bir də gördü ki, sandıq fironun bağına daxil oldu. Musanın bacısı bir bəhanə ilə fironun bağına girdi. Bir də gördü ki, Musaya dayə gətirirlər, lakin heç bir dayənin südünü içmir, onlar da çaşıb qalmışdılar. O vaxt Musanın bacısı qabağa çıxıb dedi: "İstəyirsinizsə, mən sizə bir dayə gətirim." Necə ki Allah-Təala gələn ayədə buyurur)**.**

**40)** (اِذْ تَمْش۪ٓي اُخْتُكَ فَتَقُولُ هَلْ اَدُلُّكُمْ عَلٰى مَنْ يَكْفُلُهُ) – (ey Musa, yadına sal)**, o zaman ki sənin bacın** (Nilin sahili ilə sandığa baxa-baxa gedirdi, sandıq bağa daxil olub, bacın da onun dalınca girib gördü ki, sənin üçün dayə axtarırlar. Sən isə heç bir dayənin südünü içmirsən, o vaxt da bacın) **dedi ki, sizə ona baxacaq** (uşağın onun südünü içəcəyi) **birini göstərməyimi istəyirsiniz?** (Musanın bacısı bu sözü dedikdə, fironun xanımı Asiya əmr etdi ki, o qadını çağırsınlar. Musanın bacısı gedib anasını gətirdi. Musanı anasına verəndə anasının qucağında onun ətrindən Musa rahatlanıb onun südündən içdi)**.** (فَرَجَعْنَاكَ اِلٰٓى اُمِّكَ كَيْ تَقَرَّ عَيْنُهَا وَلَا تَحْزَنَ) - (ey Musa)**, səni anana qaytardıq ki, gözü aydın olub məhzun və qəmgin olmasın.** (وَقَتَلْتَ نَفْسًا فَنَجَّيْنَاكَ مِنَ الْغَمِّ وَفَتَنَّاكَ فُتُونًا) – (ey Musa)**, bir nəfəri** (qibtini) **qətlə yetirdin, onun qəm-qüssəsindən sənə nicat verdik və səni necə bəlalara salıb** (hamısından xilas etdik. Allah-Təala Musanı bir çox bəlalara salıb sonra xilas etdi, əvvəlcə firon bəni-İsrailin təzə anadan olan

فَلَبِثْتَ سِنِينَ فِي اَهْلِ مَدْيَنَ ثُمَّ جِئْتَ عَلٰى قَدَرٍ يَا مُوسٰى ﴿٤٠﴾ وَاصْطَنَعْتُكَ لِنَفْسِيۚ ﴿٤١﴾ اِذْهَبْ
اَنْتَ وَاَخُوكَ بِاٰيَاتِي وَلَا تَنِيَا فِي ذِكْرِيۚ ﴿٤٢﴾ اِذْهَبَٓا اِلٰى فِرْعَوْنَ اِنَّهُ طَغٰىۚ ﴿٤٣﴾ فَقُولَا لَهُ قَوْلًا لَيِّنًا
لَعَلَّهُ يَتَذَكَّرُ اَوْ يَخْشٰى ﴿٤٤﴾ قَالَا رَبَّنَٓا اِنَّنَا نَخَافُ اَنْ يَفْرُطَ عَلَيْنَٓا اَوْ اَنْ يَطْغٰى ﴿٤٥﴾

---

oğlan uşaqlarını qətlə yetirəndə, onların arasında öldürülməkdən, ondan sonra sandığın içində olarkən Nildə onu qərq olmaqdan, sonra qibtini öldürsə də, onun şərindən, bütün bunların hamısından Allah-Təala Musaya nicat verib, ona verdiyi nemətləri bu ayədə bəyan edir. Musa 12 yaşında olanda Misirli bir şəxs bəni-İsraildən bir qibtiylə dava edəndə Musa o yəhudiyə kömək edib o qibtiyə bir yumruq vurdu. Öldürmək istəməsə də, qibti o zərbədən öldü. Bu qissə Qəsəs surəsində qeyd olunub). (فَلَبِثْتَ سِنِينَ فِي اَهْلِ مَدْيَنَ) - (ey Musa, qibtini öldürəndən sonra qaçıb Mədyən şəhərinə gedib) **illərlə** (28 il) **Mədyən əhlinin arasında** (Şüeybin yanında) **qaldın.** (O zamanlar səni qoruyub saxladıq). (ثُمَّ جِئْتَ عَلٰى قَدَرٍ يَا مُوسٰى) – (sonra Mədyəndən çıxıb, bizim tərəfimizdən) **müəyyən olunmuş bir vaxta** (peyğəmbərlik yaşına) **gəlib çatdın** (və sənə peyğəmbərlik vəzifəsini verdim)**.**

**41)** (وَاصْطَنَعْتُكَ لِنَفْسِي) - (ey Musa)**, səni özümçün** (peyğəmbər) **seçdim** (ki, yer üzündə mənim canişinim olub vəhyimi bəndələrimə çatdırasan)**.**

**42)** (اِذْهَبْ اَنْتَ وَاَخُوكَ بِاٰيَاتِي وَلَا تَنِيَا فِي ذِكْرِي) - (ey Musa,) **sən və qardaşın** (Harun) **verdiyim möcüzələrimlə gedib** (xalqı mənim tərəfimə dəvət edin)**. Məni zikr edib** (hökmlərimi xalqa çatdırmaqda tənbəllik etməyin. Musa peyğəmbərlik məqamına çatıb xalqı tövhidə dəvət etməklə əmr olunduqda, ailəsini o biyabanda qoyub Turi-Sinadan birbaşa Misirə yollandı. Mədyən əhlindən gəlib-gedənlər Şüeybin qızı Səfurəni (Sapuranı) tanıyıb onları götürüb Şüeybin yanına Mədyənə apardılar. O biri tərəfdən Allah-Təala Misirdə Haruna vəhy göndərib ona Musanın qarşısına çıxmağı əmr etdi. Harun yaşda Musadan böyük idi. Harun Musanın qarşısına çıxıb vəhy əhvalatını Musaya xəbər verdi. Hər ikisi birlikdə Misirə, bəni-İsrailin yanına daxil oldular, ondan sonra Allah-Təala hər ikisinə Misirdə vəhy göndərdi)**.**

**43)** (اِذْهَبَا اِلٰى فِرْعَوْنَ اِنَّهُ طَغٰى) - (ey Musa və Harun)**, fironun yanına gedin, həqiqətən, o, tüğyan edib həddini aşıbdır.** (Onu mənim tərəfimə dəvət edin)**.**

**44)** (فَقُولَا لَهُ قَوْلًا لَيِّنًا لَعَلَّهُ يَتَذَكَّرُ اَوْ يَخْشٰى) – (fironun dəvətinə getdikdə) **onunla** (qəzəblə yox)**, yumşaq danışın,** (ümidiniz bu olsun ki,) **bəlkə, öyüd-nəsihət qəbul edib, ya da qorxub** (Mənə itaət etsin)**.**

**45)** (قَالَا رَبَّنَا اِنَّنَا نَخَافُ اَنْ يَفْرُطَ عَلَيْنَا اَوْ اَنْ يَطْغٰى) – (Musa və Harun) **dedilər: "Ey bizim rəbbimiz, həqiqətən, biz qorxuruq ki,** (firon bizə danışmağa möhlət

قَالَ لَا تَخَافَآ اِنَّنِي مَعَكُمَآ اَسْمَعُ وَاَرٰى ﴿٤٦﴾ فَأْتِيَاهُ فَقُولَآ اِنَّا رَسُولَا رَبِّكَ فَاَرْسِلْ مَعَنَا بَنِي اِسْرَآءِيلَ وَلَا تُعَذِّبْهُمْ قَدْ جِئْنَاكَ بِاٰيَةٍ مِنْ رَبِّكَ وَالسَّلَامُ عَلٰى مَنِ اتَّبَعَ الْهُدٰى ﴿٤٧﴾ اِنَّا قَدْ اُوحِيَ اِلَيْنَا اَنَّ الْعَذَابَ عَلٰى مَنْ كَذَّبَ وَتَوَلّٰى ﴿٤٨﴾ قَالَ فَمَنْ رَبُّكُمَا يَا مُوسٰى ﴿٤٩﴾ قَالَ رَبُّنَا الَّذِي اَعْطٰى كُلَّ شَيْءٍ خَلْقَهُ ثُمَّ هَدٰى ﴿٥٠﴾

---

verməyib bizi öldürməyə) **tələssin, ya da həddini aşıb** (Sənin haqqında nalayiq sözlər desin)**.”**

**46)** (قَالَ لَا تَخَافَآ اِنَّنِي مَعَكُمَآ اَسْمَعُ وَاَرٰى) – (Allah-Təala) **buyurdu: “Qorxmayın, həqiqətən, mən sizinlə olub** (kömək edib, fironun şərindən qoruyaram və sizin aranızda olan hər bir əməli və danışığı) **eşidib görürəm.** (Heç vaxt ondan qorxmayın. Mənim sizi qoruyub kömək edəcəyimə etimad edin)**.**

**47)** (فَأْتِيَاهُ فَقُولَآ اِنَّا رَسُولَا رَبِّكَ) – (fironun) **yanına gedib ona deyin ki, həqiqətən, biz sənin rəbbin Allah-Təalanın peyğəmbərləriyik,** (tək və yeganə olan Allah-Təalaya iman gətir)**.** (فَاَرْسِلْ مَعَنَا بَنِي اِسْرَآءِيلَ وَلَا تُعَذِّبْهُمْ) – **bəni-İsraili** (zəhmətli və məşəqqətli əməllərdən xilas edib) **bizə həvalə et və onlardan əl çəkib** (zülm etmə, bizimlə göndər)**.** (Firon bəni-İsraili məşəqqətli əməllərə düçar edib onlara əzab etdiyindən Allah-Təala Musa və Haruna buyurur: “firondan bəni-İsrailin xilas olmasını xahiş edin)**.** (قَدْ جِئْنَاكَ بِاٰيَةٍ مِنْ رَبِّكَ) – (ona deyin ki, ey firon)**, həqiqətən, dəlil və sübutla rəbbin Allah-Təalanın tərəfindən sənin yanına gəlmişik.”** (Hər bir peyğəmbər təbliğə başlayanda ona dəlil və sübut lazım olduğundan, Musa və Harun fironu dəvət edərkən əvvəlcə Allah-Təalanın onlara bəxş etdiyi dəlil və sübutı firona bildirdilər, yəni səni dəvət etməyimiz dəlil və sübutsız deyildir)**.** (وَالسَّلَامُ عَلٰى مَنِ اتَّبَعَ الْهُدٰى) – (hidayət tapıb) **haqqa tabe olan şəxslərə Allah-Təalanın salam və rəhməti olsun.**

**48)** (اِنَّا قَدْ اُوحِيَ اِلَيْنَا اَنَّ الْعَذَابَ عَلٰى مَنْ كَذَّبَ وَتَوَلّٰى) – (firona deyin ki,) **həqiqətən, Allah-Təala tərəfindən bizə belə vəhy olunubdur: kim məndən üz döndərib** (peyğəmbərlərimi və ayələrimi) **təkzib etsə,** (ondan ötrü axirətdə) **əzabım hazırdır.** (Musa və Harun son dərəcə qorxu və iztirab içində olsalar da, Allah-Təalanın əmri ilə fironun yanına gedib Allah-Təalanın əmrlərini ona çatdırdılar)**.**

**49)** (قَالَ فَمَنْ رَبُّكُمَا يَا مُوسٰى) – (firon) **dedi: ey Musa, sizin rəbbiniz kimdir** (ki, məni onun tərəfinə və ona iman gətirməyə dəvət edirsiniz?)

**50)** (قَالَ رَبُّنَا الَّذِي اَعْطٰى كُلَّ شَيْءٍ خَلْقَهُ ثُمَّ هَدٰى) – (Musa fironun cavabında) **dedi: bizim rəbbimiz o Allahdır ki, hər şeyə** (layiq olduğu) **xilqətini verib və sonra** (ona lazım olan əzalar verərək necə istifadə edəcəyini) **bildirib, hidayət edibdir.**

قَالَ فَمَا بَالُ الْقُرُونِ الْاُولٰى ﴿٥١﴾ قَالَ عِلْمُهَا عِنْدَ رَبّ۪ي ف۪ي كِتَابٍۚ لَا يَضِلُّ رَبّ۪ي وَلَا يَنْسٰىۘ
﴿٥٢﴾ اَلَّذ۪ي جَعَلَ لَكُمُ الْاَرْضَ مَهْدًا وَسَلَكَ لَكُمْ ف۪يهَا سُبُلًا وَاَنْزَلَ مِنَ السَّمَٓاءِ مَٓاءًۜ فَاَخْرَجْنَا
بِه۪ٓ اَزْوَاجًا مِنْ نَبَاتٍ شَتّٰى ﴿٥٣﴾ كُلُوا وَارْعَوْا اَنْعَامَكُمْۜ اِنَّ ف۪ي ذٰلِكَ لَاٰيَاتٍ لِاُولِي النُّهٰىۚ
﴿٥٤﴾ مِنْهَا خَلَقْنَاكُمْ وَف۪يهَا نُع۪يدُكُمْ وَمِنْهَا نُخْرِجُكُمْ تَارَةً اُخْرٰى ﴿٥٥﴾ وَلَقَدْ اَرَيْنَاهُ اٰيَاتِنَا كُلَّهَا
فَكَذَّبَ وَاَبٰى ﴿٥٦﴾

---

**51)** (قَالَ فَمَا بَالُ الْقُرُونِ الْاُولٰى) – (firon) **dedi: bəs** (özlərinə peyğəmbər gəlməyən) **əvvəlki halı necədir,** (kim bədbəxt, kim xoşbəxtdir?)

**52)** (قَالَ عِلْمُهَا عِنْدَ رَبّ۪ي ف۪ي كِتَابٍ لَا يَضِلُّ رَبّ۪ي وَلَا يَنْسٰى) – (Musa) **dedi:** (bu soruşduğunuz qeyb elmidir, mən qeyb elmini bilmirəm)**, onlara dair elm mənim rəbbim Allah-Təalanın elmində** (dərgahındakı Lövhi-məhfuz) **kitabında yazılıb,** (saxlanılıbdır)**, rəbbim Allah-Təala o elmləri nə itirməz, nə də unutmaz,** (onların elmi Allah-Təalanın yanında sabit və bərqərardır)**.**

**53)** (اَلَّذ۪ي جَعَلَ لَكُمُ الْاَرْضَ مَهْدًا) **- mənim rəbbim o Allah-Təaladır ki, yer üzünü sizdən ötrü döşəyib hazır edib ki,** (orada yerləşib rahat olasınız, necə ki uşaq beşikdə rahat olur)**.** (وَسَلَكَ لَكُمْ ف۪يهَا سُبُلًا) – **sizin üçün** (o dağların arasında) **yollar salıb,** (belə ki, o yollarla gedib məqsədinizə çatasınız, əgər yer üzünün hamısını dağ etsəydi, sizin üçün yaşamaq çətin olardı. Bu sözün təsdiqi yer üzündə gəzənlərə məlumdur. Çox hündür dağlar var ki, onların zirvəsinə çıxmaq mümkün deyil, Allah-Təala onların arasında düz yollar salıbdır)**.** (وَاَنْزَلَ مِنَ السَّمَٓاءِ مَٓاءً) – (Allah-Təala sizdən ötrü) **səmadan yağış göndərir** (ki, o yağışın səbəbinə həyatınız asan keçsin)**.** (فَاَخْرَجْنَا بِه۪ٓ اَزْوَاجًا مِنْ نَبَاتٍ شَتّٰى)–(rəbbiniz Allah-Təala buyurur: səmadan gələn suyun səbəbinə) **hər cür bitkidən cütlər yetişdirdik.**

**54)** (كُلُوا وَارْعَوْا اَنْعَامَكُمْ) – (yerdə bitən şeylərdən) **yeyib, heyvanlarınızı da otarın,** (اِنَّ ف۪ي ذٰلِكَ لَاٰيَاتٍ لِاُولِي النُّهٰى) **- həqiqətən, bu** (qeyd olunan) **şeylərdə Allah-Təalanın** (tövhid və qüdrətini düşünüb, düz əməl edən) **ağıl sahiblərindən ötrü dəlil və sübutlar vardır.**

**55)** (مِنْهَا خَلَقْنَاكُمْ) – **sizi haradan** (torpaqdan) **yaratmışıqsa,** (وَف۪يهَا نُع۪يدُكُمْ) – (öldürüb yenə) **ora qaytaracağıq.** (وَمِنْهَا نُخْرِجُكُمْ تَارَةً اُخْرٰى) – **bir daha sizi oradan çıxarıb,** (həyat verib, qiyamət günü bir yerə toplayacağıq. Musanın firona verdiyi cavab bitdi)**.**

**56)** (وَلَقَدْ اَرَيْنَاهُ اٰيَاتِنَا كُلَّهَا فَكَذَّبَ وَاَبٰى) **- həqiqətən,** (Musaya bəxş etdiyimiz) **möcüzələrimizin hamısını** (firona) **göstərdik. Hamısını təkzib edib** (heç birini) **qəbul etmədi.** (Firona göstərdiyi möcüzələri bundan sonra bəyan edir)**.**

قَالَ اَجِئْتَنَا لِتُخْرِجَنَا مِنْ اَرْضِنَا بِسِحْرِكَ يَا مُوسٰى ﴿٥٧﴾ فَلَنَأْتِيَنَّكَ بِسِحْرٍ مِثْلِهٖ فَاجْعَلْ بَيْنَنَا وَبَيْنَكَ
مَوْعِدًا لَا نُخْلِفُهُ نَحْنُ وَلَآ اَنْتَ مَكَانًا سُوًى ﴿٥٨﴾ قَالَ مَوْعِدُكُمْ يَوْمُ الزِّينَةِ وَاَنْ يُحْشَرَ النَّاسُ
ضُحًى ﴿٥٩﴾ فَتَوَلّٰى فِرْعَوْنُ فَجَمَعَ كَيْدَهُ ثُمَّ اَتٰى ﴿٦٠﴾ قَالَ لَهُمْ مُوسٰى وَيْلَكُمْ لَا تَفْتَرُوا عَلَى اللّٰهِ
كَذِبًا فَيُسْحِتَكُمْ بِعَذَابٍ وَقَدْ خَابَ مَنِ افْتَرٰى ﴿٦١﴾

---

**57)** (قَالَ اَجِئْتَنَا لِتُخْرِجَنَا مِنْ اَرْضِنَا بِسِحْرِكَ يَا مُوسٰى) – (Hz. Musa firona əsanın əjdəha olmasını və ağappaq əlini göstərəndən sonra firon) **dedi: ey Musa, sən gəlibsən ki, bu sehrin səbəbinə bizi öz** (Misir) **torpağımızdan çıxarıb** (özün səltənət sahibi olasan? Fironun bu sözündən məlum olur ki, Musanın haqlı olduğunu dərk edib qorxduğundan belə deyir. Yoxsa böyük bir hökmdar sehrbaza necə deyər ki, sən bizi sehrlə Misirdən çıxartmaq üçün gəlibsən. Bir sehrbaz böyük bir hökmdarı necə öz ölkəsindən qova bilər? Bu sözü o şəxs deyər ki, məğlub olduğunu anlasın, ya da bu ehtimaldan çəkinsin. Firon da Musanın haqlı olduğunu gördüyündən, ya da zənn etdiyindən belə bir söz dedi)**.**

**58)** (فَلَنَأْتِيَنَّكَ بِسِحْرٍ مِثْلِهٖ) – (ey Musa)**, əlbəttə, biz də sənə onun kimi bir sehr gətirərik.** (فَاجْعَلْ بَيْنَنَا وَبَيْنَكَ مَوْعِدًا) – (ey Musa)**, bizimlə öz aranda müəyyən bir vaxt təyin et.** (لَا نُخْلِفُهُ نَحْنُ وَلَآ اَنْتَ مَكَانًا سُوًى) **- nə biz, nə də** (ey Musa) **sən ona xilaf çıxmayaq,** (ikimizə də) **müsaid yer olsun.** (Belə ki, sənin doğru, yoxsa yalançı olduğun məlum olsun)**.**

**59)** (قَالَ مَوْعِدُكُمْ يَوْمُ الزِّينَةِ) – (Musa) **dedi: vədəniz* bayram günü olsun.** (وَاَنْ يُحْشَرَ النَّاسُ ضُحًى) **- və günorta bütün insanlar** (orada) **toplansın.** (Ta ki haqla batil məlum olsun)**.**

*(****Qeyd:*** *Misir xalqı bayram günlərində bir yerə toplanıb şadlıq keçirtdiyindən Hz. Musa bayram gününü seçdi. Bu bayram günü Misir xalqının arasında məşhur olan Nilə qurban vermə bayramı idi. Misirdə qədimdən adət idi ki, ildə bir gün seçib, o gün gözəl bir qızı qurbanlıq olaraq bəzəyib Nilə atardılar ki, Nilin suyu daha da artsın. H. 18-ci ildə xilaskar islam ordusu tərəfindən Misir fəth olunandan sonra Misirin fatehi Əmr ibnül-As tərəfindən bu çirkin əməl qadağan edildi).*

**60)** (فَتَوَلّٰى فِرْعَوْنُ فَجَمَعَ كَيْدَهُ ثُمَّ اَتٰى) – (bu danışıqdan sonra) **firon dönüb getdi,** (Musa da onun yanından ayrıldı)**, firon hər bir məkr və hiyləsini** (sehrbazları) **toplayıb sonra** (təyin olunmuş vaxtda) **gəldi.** (Musa da gəlib sehrbazların qarşısında dayandı)**.**

**61)** (قَالَ لَهُمْ مُوسٰى وَيْلَكُمْ لَا تَفْتَرُوا عَلَى اللّٰهِ كَذِبًا) **- Musa** (sehrbazlara) **dedi: ey sehrbazlar, vay sizin halınıza, Allah-Təalaya yalandan iftira etməyin.** (فَيُسْحِتَكُمْ بِعَذَابٍ وَقَدْ خَابَ مَنِ افْتَرٰى) **- o vaxt da** (Allah-Təala) **əzab** (göndərib) **sizi həlak edər. Həqiqətən, kim yalandan** (Allah-Təalaya) **iftira edərsə, özünə zərər verər.**

فَتَنَازَعُوٓا اَمْرَهُمْ بَيْنَهُمْ وَاَسَرُّوا النَّجْوٰى ﴿٦٢﴾ قَالُوٓا اِنْ هٰذَانِ لَسَاحِرَانِ يُرِيدَانِ اَنْ يُخْرِجَاكُمْ
مِنْ اَرْضِكُمْ بِسِحْرِهِمَا وَيَذْهَبَا بِطَرِيقَتِكُمُ الْمُثْلٰى ﴿٦٣﴾ فَاَجْمِعُوا كَيْدَكُمْ ثُمَّ ائْتُوا صَفًّاۚ وَقَدْ
اَفْلَحَ الْيَوْمَ مَنِ اسْتَعْلٰى ﴿٦٤﴾ قَالُوا يَا مُوسٰٓى اِمَّآ اَنْ تُلْقِيَ وَاِمَّآ اَنْ نَكُونَ اَوَّلَ مَنْ اَلْقٰى ﴿٦٥﴾
قَالَ بَلْ اَلْقُواۚ فَاِذَا حِبَالُهُمْ وَعِصِيُّهُمْ يُخَيَّلُ اِلَيْهِ مِنْ سِحْرِهِمْ اَنَّهَا تَسْعٰى ﴿٦٦﴾ فَاَوْجَسَ فٖي
نَفْسِهٖ خٖيفَةً مُوسٰى ﴿٦٧﴾

---

**62)** (فَتَنَازَعُوا اَمْرَهُمْ بَيْنَهُمْ وَاَسَرُّوا النَّجْوٰى) **- sehrbazlar öz işləri barəsində öz aralarında mübahisə edib gizlin danışdılar.** (Bəziləri dedilər: “Musa sehrbazdır”, bəziləri dedilər: “Sehrbaz belə olmur”, bəziləri də dedilər: “Əgər bizə qalib gəlsə, ona tabe olarıq”)**.**

**63)** (قَالُوا اِنْ هٰذَانِ لَسَاحِرَانِ يُرِيدَانِ اَنْ يُخْرِجَاكُمْ مِنْ اَرْضِكُمْ بِسِحْرِهِمَا) – (sehrbazlar bir-biriləriylə danışıb, axırda belə) **dedilər: əlbəttə, bunların ikisi də sehrbazdır, onlar istəyirlər ki, öz sehrləriylə sizi** (Misir) **torpağından çıxarıb** (hər bir işin ixtiyarı özlərində olsun)**.** (وَيَذْهَبَا بِطَرِيقَتِكُمُ الْمُثْلٰى) **və** (məqsədləri) **sizin yaxşı** (və fəzilətli) **olan yolunuzu** (sehr əməlinizi özlərinə məxsus edib sizi) **yox etməkdir.**

**64)** (فَاَجْمِعُوا كَيْدَكُمْ) **– nə ki məkr və hiylə varınızdır,** (ixtilaf etməyib)**, bir yerə toplayın.** (ثُمَّ ائْتُوا صَفًّا) **- sonra** (sehrlərinizi də götürüb) **səf-səf gəlin,** (bəlkə, Musa bu səbəbdən qorxub məğlub olsun)**.** (وَقَدْ اَفْلَحَ الْيَوْمَ مَنِ اسْتَعْلٰى) **- həqiqətən, bu gün kim** (düşmənə) **qalib olsa, o şəxs** (böyük dərəcə sahibi olub) **nicat tapıbdır.**

**65)** (قَالُوا يَا مُوسٰى اِمَّا اَنْ تُلْقِيَ وَاِمَّا اَنْ نَكُونَ اَوَّلَ مَنْ اَلْقٰى) **-** (sehrbazlar ədəbə riayət edib Musaya) **dedilər: ey Musa, ya sən** (öncə əsanı) **at, ya da öncə** (şeylərini) **atan biz olaq.**

**66)** (قَالَ بَلْ اَلْقُوا) **–** (Musa da ədəbə riayət edib) **buyurdu: xeyr,** (öncə) **siz atın.** (Musanın onları qabağa salmaqda məqsədi o idi ki, xalq öncə onların atdığı şeylərə diqqət edib, sehrbazların elm və məharətlərindən agah olsunlar. Sonra da Musa əsasını atıb onları yox edəndə xalq bunun Allah-Təala tərəfindən möcüzə olduğunu anlayıb, şəkk-şübhə etməsinlər)**.** (فَاِذَا حِبَالُهُمْ وَعِصِيُّهُمْ يُخَيَّلُ اِلَيْهِ مِنْ سِحْرِهِمْ اَنَّهَا تَسْعٰى) **-** (Musa onlara izin verib sehrbazlar öz şeylərini meydana atdıqda, Musaya) **elə gəldi ki, onların** (düzəltdikləri) **ipləri və ağacları, sanki, sehrin təsirindən hərəkət edirlər.** (Əslində, o şeylərin həqiqəti yox idi)**.**

**67)** (فَاَوْجَسَ فٖي نَفْسِهٖ خٖيفَةً مُوسٰى) **-** (belə məqamlarda insan təbiətinin nəticəsi olaraq) **Musa öz içində qorxu hiss etdi.**

قُلْنَا لَا تَخَفْ اِنَّكَ اَنْتَ الْاَعْلٰى ﴿٦٨﴾ وَاَلْقِ مَا فٖي يَمٖينِكَ تَلْقَفْ مَا صَنَعُواۜ اِنَّمَا صَنَعُوا كَيْدُ سَاحِرٍۜ
وَلَا يُفْلِحُ السَّاحِرُ حَيْثُ اَتٰى ﴿٦٩﴾ فَاُلْقِيَ السَّحَرَةُ سُجَّدًا قَالُوٓا اٰمَنَّا بِرَبِّ هٰرُونَ وَمُوسٰى ﴿٧٠﴾
قَالَ اٰمَنْتُمْ لَهُ قَبْلَ اَنْ اٰذَنَ لَكُمْۜ اِنَّهُ لَكَبٖيرُكُمُ الَّذٖي عَلَّمَكُمُ السِّحْرَۚ فَلَاُقَطِّعَنَّ اَيْدِيَكُمْ وَاَرْجُلَكُمْ مِنْ
خِلَافٍ وَلَاُصَلِّبَنَّكُمْ فٖي جُذُوعِ النَّخْلِۘ وَلَتَعْلَمُنَّ اَيُّنَٓا اَشَدُّ عَذَابًا وَاَبْقٰى ﴿٧١﴾ قَالُوا لَنْ نُؤْثِرَكَ عَلٰى
مَا جَٓاءَنَا مِنَ الْبَيِّنَاتِ وَالَّذٖي فَطَرَنَا

---

**68)** (قُلْنَا لَا تَخَفْ اِنَّكَ اَنْتَ الْاَعْلٰى) - (Allah-Təala buyurur: Musaya vəhy göndərib) **dedik: qorxma, həqiqətən, sən** (onlara) **üstün olub** (qalib gələcəksən).

**69)** (وَاَلْقِ مَا فٖي يَمٖينِكَ تَلْقَفْ مَا صَنَعُوا) – (ey Musa, onların sehrlərinin çoxluğundan qorxma, sənin əlindəki o əsa Allah-Təalanın izni ilə onların hamısına qalib gələcək). **Sağ əlindəki** (əsanı yerə) **at ki,** (sehrlə düzəltdikləri) **o şeylərin hamısını udsun.** (اِنَّمَا صَنَعُوا كَيْدُ سَاحِرٍ) **- həqiqətən, onların düzəltdikləri ancaq sehrbazların məkr və hiyləsidir.** (Həqiqəti olmayan batil şeylərdir, sən onlardan heç qorxma). (وَلَا يُفْلِحُ السَّاحِرُ حَيْثُ اَتٰى) – **sehrbaz nəylə** (hansı sehrlə) **gəlsə də, onun üçün nicat yoxdur,** (məğlub olacaqdır. Allah-Təalanın əmriylə Musa əsanı yerə atınca qorxunc bir əjdəha oldu, sehrbazların bütün şeylərini udub yox etdi).

**70)** (فَاُلْقِيَ السَّحَرَةُ سُجَّدًا) – (sehrbazlarin sehri batil olub, Musanın haqlılığı onlara məlum olduqda üzü üstə yıxılıb Allah-Təalaya) **səcdə etdilər,** (قَالُوا اٰمَنَّا بِرَبِّ هٰرُونَ وَمُوسٰى) – (səcdə edib) **dedilər: Biz Harunla Musanın tərbiyə verən məbuduna iman gətirdik.**

**71)** (قَالَ اٰمَنْتُمْ لَهُ قَبْلَ اَنْ اٰذَنَ لَكُمْ) – (firon bu əhvalatı görəndə qəzəblənib, sehrbazları çağırıb) **dedi: mən sizə izin vermədən əvvəl** (Musaya) **iman gətirdiniz?** (Əgər mən sizə izin versəydim, gərək, o zaman ona iman gətirəydiniz). (اِنَّهُ لَكَبٖيرُكُمُ الَّذٖي عَلَّمَكُمُ السِّحْرَ) **- həqiqətən,** (indi mənə belə məlum oldu ki,) **sizin böyüyünüz Musadır. Sehri də sizə o öyrədib.** (فَلَاُقَطِّعَنَّ اَيْدِيَكُمْ وَاَرْجُلَكُمْ مِنْ خِلَافٍ) **- əlbəttə, sizin əllərinizi və ayaqlarınızı çarpaz** (birini sağdan, birini soldan) **kəsdirəcəyəm.** (Əl və ayağı belə çarpaz kəsdirən ilk şəxs firondur). (وَلَاُصَلِّبَنَّكُمْ فٖي جُذُوعِ النَّخْلِ) **- əlbəttə** (ondan sonra) **sizi xurma ağacının kötüyündən asıb** (həlak edəcəyəm). (وَلَتَعْلَمُنَّ اَيُّنَٓا اَشَدُّ عَذَابًا وَاَبْقٰى) **- əlbəttə, tezliklə bilərsiniz ki, hansı birimizin** (mənim, yoxsa Musanın) **əzabı şiddətli və davamlıdır?** (Firon özü çox zalım olduğundan heç vaxt zülm etməmiş Hz. Musanı da özü kimi sayıb, ona istehza edib belə dedi).

**72)** (قَالُوا لَنْ نُؤْثِرَكَ عَلٰى مَا جَٓاءَنَا مِنَ الْبَيِّنَاتِ وَالَّذٖي فَطَرَنَا) – (sehrbazlar fironun cavabında) **dedilər: biz səni heç vaxt** (Musanın haqq olduğuna dair gələn) **dəlillərdən və** (bizi yoxdan) **yaradan** (Allah-Təaladan) **üstün tutub** (sita-

فَاقْضِ مَٓا اَنْتَ قَاضٍۜ اِنَّمَا تَقْضِي هٰذِهِ الْحَيٰوةَ الدُّنْيَاۜ ﴿٧٢﴾ اِنَّٓا اٰمَنَّا بِرَبِّنَا لِيَغْفِرَ لَنَا خَطَايَانَا وَمَٓا
اَكْرَهْتَنَا عَلَيْهِ مِنَ السِّحْرِۜ وَاللّٰهُ خَيْرٌ وَاَبْقٰى ﴿٧٣﴾ اِنَّهُ مَنْ يَأْتِ رَبَّهُ مُجْرِمًا فَاِنَّ لَهُ جَهَنَّمَۜ لَا يَمُوتُ
فِيهَا وَلَا يَحْيٰى ﴿٧٤﴾ وَمَنْ يَأْتِهِ مُؤْمِنًا قَدْ عَمِلَ الصَّالِحَاتِ فَاُو۬لٰٓئِكَ لَهُمُ الدَّرَجَاتُ الْعُلٰىۙ ﴿٧٥﴾
جَنَّاتُ عَدْنٍ تَجْرِي مِنْ تَحْتِهَا الْاَنْهَارُ خَالِدِينَ فِيهَاۜ وَذٰلِكَ جَزٰٓؤُا مَنْ تَزَكّٰى ﴿٧٦﴾ وَلَقَدْ اَوْحَيْنَٓا
اِلٰى مُوسٰٓى اَنْ اَسْرِ بِعِبَادِي فَاضْرِبْ لَهُمْ طَرِيقًا فِي الْبَحْرِ يَبَسًاۙ لَا تَخَافُ دَرَكًا وَلَا تَخْشٰى ﴿٧٧﴾

---

yiş etməyəcəyik). (فَاقْضِ مَٓا اَنْتَ قَاضٍ) – **nə hökm edəcəksənsə, et.** (اِنَّمَا تَقْضِي هٰذِهِ الْحَيٰوةَ الدُّنْيَا) – **həqiqətən, sən ancaq bu dünya həyatında hökm edə bilərsən.** (Tezliklə sənin hökmün yox olacaq. Əsl hökm axirət hökmüdür. O da Allah-Təalanın ixtiyarındadır).

**73)** (اِنَّٓا اٰمَنَّا بِرَبِّنَا لِيَغْفِرَ لَنَا خَطَايَانَا وَمَٓا اَكْرَهْتَنَا عَلَيْهِ مِنَ السِّحْرِ) **- həqiqətən, biz rəbbimiz Allah-Təalaya iman gətirdik ki, bizim günahlarımıza və sənin** (Musaya qarşı) **bizə zorla etdirdiyin sehrə görə bizə bağışlasın.** (Sehrbazlar əvvəlcə Musaya fikir verdilər, onda doğruluq əlamətlərini görəndə, ona qarşı sehr etmək istəmədilər, lakin firon onları buna məcbur etdi). (وَاللّٰهُ خَيْرٌ وَاَبْقٰى) – (Allah-Təala itaət edənlərə əcr və savab vermək baxımından) **səndən yaxşıdır,** (asilərə olan əzabı da) **əbədidir.** (Sehrbazların bu sözü fironun bayaqkı – mən, yoxsa Musa daha çox əzab edər, sözünün rəddi üçündür).

**74)** (اِنَّهُ مَنْ يَأْتِ رَبَّهُ مُجْرِمًا فَاِنَّ لَهُ جَهَنَّمَ لَا يَمُوتُ فِيهَا وَلَا يَحْيٰى) **- həqiqətən, kim ki,** (qiyamət günü) **öz rəbbi Allah-Təalanın hüzuruna günahkar olaraq gəlsə, əlbəttə, ondan ötrü cəhənnəmdə əzab vardır, orada nə ölər** (ki, xilas olsun), **nə də diri qalar** (ki, bir mənfəət əldə etsin).

**75)** (وَمَنْ يَأْتِهِ مُؤْمِنًا قَدْ عَمِلَ الصَّالِحَاتِ) – **kim** (qiyamət günü) **Allah-Təalanın hüzuruna yaxşı əməllər etmiş mömin olaraq gəlsə,** (فَاُو۬لٰٓئِكَ لَهُمُ الدَّرَجَاتُ الْعُلٰى) **- elə şəxslərdən ötrü** (axirətdə) **uca dərəcələr vardır.**

**76)** (جَنَّاتُ عَدْنٍ تَجْرِي مِنْ تَحْتِهَا الْاَنْهَارُ خَالِدِينَ فِيهَا) - (qəsrlərinin və ağaclarının) **altından çaylar axan** (uca) **Ədn cənnətləri,** (وَذٰلِكَ جَزٰٓؤُا مَنْ تَزَكّٰى) – **bu** (cənnətlər hər cür günahdan) **pak və pakizə olanların mükafatıdır,** (burada Musaya iman gətirən sehrbazların sözü bitdi, ondan sonra fironun əmri ilə sehrbazları qətlə yetirdilər, Hz. Musa bəni-İsraili gecə vaxtı götürüb Misirdən çıxdı, necə ki növbəti ayələrdə Allah-Təala xəbər verir).

**77)** (وَلَقَدْ اَوْحَيْنَٓا اِلٰى مُوسٰٓى اَنْ اَسْرِ بِعِبَادِي) **- həqiqətən, biz Musaya vəhy edib dedik:** (ey Musa), **bəndələrim olan** (bəni-İsraili götürüb) **gecə vaxtı** (Misirdən) **çıx.** (فَاضْرِبْ لَهُمْ طَرِيقًا فِي الْبَحْرِ يَبَسًا لَا تَخَافُ دَرَكًا وَلَا تَخْشٰى) – (əgər firon gəlib sizə çatsa, o vaxt da onlardan ötrü mənim iznimlə) **dənizdə quru bir yol aç,** (əsanı dənizə vur ki, yol açılsın, bu yola girdikdən sonra da fironun)

فَاَتْبَعَهُمْ فِرْعَوْنُ بِجُنُودِه۪ فَغَشِيَهُمْ مِنَ الْيَمِّ مَا غَشِيَهُمْ ﴿٧٨﴾ وَاَضَلَّ فِرْعَوْنُ قَوْمَهُ وَمَا هَدٰى ﴿٧٩﴾
يَا بَن۪ٓي اِسْرَٓاء۪يلَ قَدْ اَنْجَيْنَاكُمْ مِنْ عَدُوِّكُمْ وَوٰعَدْنَاكُمْ جَانِبَ الطُّورِ الْاَيْمَنَ وَنَزَّلْنَا عَلَيْكُمُ الْمَنَّ
وَالسَّلْوٰى ﴿٨٠﴾ كُلُوا مِنْ طَيِّبَاتِ مَا رَزَقْنَاكُمْ وَلَا تَطْغَوْا ف۪يهِ فَيَحِلَّ عَلَيْكُمْ غَضَب۪يۚ وَمَنْ يَحْلِلْ
عَلَيْهِ غَضَب۪ي فَقَدْ هَوٰى ﴿٨١﴾ وَاِنّ۪ي لَغَفَّارٌ لِمَنْ تَابَ وَاٰمَنَ وَعَمِلَ صَالِحًا ثُمَّ اهْتَدٰى ﴿٨٢﴾ وَمَٓا
اَعْجَلَكَ عَنْ قَوْمِكَ يَا مُوسٰى ﴿٨٣﴾

---

**sizə gəlib çatmasından qorxub əndişə etmə,** (sənə layiq də deyil ki, Allah-Təalanın düşmənindən qorxasan)**.**

**78)** (فَاَتْبَعَهُمْ فِرْعَوْنُ بِجُنُودِه۪) **-** (Musanın Misirdən çıxmağından firon xəbərdar olub) **qoşunla** (Musanın) **dalınca yola düşdü.** (Qırmızı dənizin sahilində firon onlara çatdı, lakin Allah-Təalanın izni ilə bəni-İsraildən ötrü dənizdə yol açılıb dənizə daxil oldular, firon da onlara tabe olub qoşunla dənizə girdi)**.** (فَغَشِيَهُمْ مِنَ الْيَمِّ مَا غَشِيَهُمْ) **-** (firon və qoşunu dənizə daxil olduqda)**, dəniz** (təlatümə gəlib) **onları qərq etdi,** (bəni-İsrail isə nicat tapdı. Ancaq Allah-Təala bilir ki, firon və əhli necə həlak oldular?)

**79)** (وَاَضَلَّ فِرْعَوْنُ قَوْمَهُ وَمَا هَدٰى) **- firon öz qövmünü** (qibtiləri) **zəlalətə salıb onları hidayət etdirmədi** (buna mane oldu)**,** (hamısı Allah-Təalanın qəzəbi ilə həlak oldular)**.** (Bəni-İsrail nicat tapıb dənizdən quruya çıxdıqda, Allah-Təala gələn ayə ilə bəni-İsrailə xitab etdi:)

**80)** (يَا بَن۪ٓي اِسْرَٓاء۪يلَ قَدْ اَنْجَيْنَاكُمْ مِنْ عَدُوِّكُمْ) **- ey bəni İsrail, həqiqətən, sizə düşməniniz** (firondan) **nicat verib** (onu qərq etdik)**.** (وَوٰعَدْنَاكُمْ جَانِبَ الطُّورِ الْاَيْمَنَ) **– və Tur dağının sağ yanında** (sizinlə danışıb Tövratı göndərəcəyimizi) **sizə vəd etdik,** (وَنَزَّلْنَا عَلَيْكُمُ الْمَنَّ وَالسَّلْوٰى) – (bu çöldə ac qalmamağınız üçün) **sizə qüdrət halvası və bildirçin göndərdik.**

**81)** (كُلُوا مِنْ طَيِّبَاتِ مَا رَزَقْنَاكُمْ) – (ey bəni İsrail)**, sizə verdiyimiz ruzilərin pakizələrindən yeyin,** (وَلَا تَطْغَوْا ف۪يهِ فَيَحِلَّ عَلَيْكُمْ غَضَب۪ي) **– və tüğyan edib** (kafir olmayın, yoxsa) **qəzəbimə düçar olarsınız.** (وَمَنْ يَحْلِلْ عَلَيْهِ غَضَب۪ي فَقَدْ هَوٰى) **– kimə qəzəbim tutsa, həqiqətən, o, həlak olar.** (Axirətdə heç vaxt nicat tapmaz)**.**

**82)** (وَاِنّ۪ي لَغَفَّارٌ لِمَنْ تَابَ وَاٰمَنَ وَعَمِلَ صَالِحًا ثُمَّ اهْتَدٰى) **- həqiqətən, mən** (Allah-Təala pis əməllərdən) **tövbə edib yaxşı əməl edənləri, sonra hidayət tapıb,** (imanında sabit olanları) **bağışlayanam.**

**83)** (وَمَٓا اَعْجَلَكَ عَنْ قَوْمِكَ يَا مُوسٰى) **-** (Hz. Musa özüylə Turi-Sinaya aparmaq üçün bəni-İsraildən 70 nəfər seçdi, onlara nəqib - vəkil deyilir)**,** (Tura gedərkən Hz. Musa tələsib, onlardan qabaq Tura varid oldu, Allah-Təaladan ona xitab gəldi:) **ey Musa, səni qövmündən** (qabaq Tura) **tələsdirən nədir?**

قَالَ هُمْ اُولَٓاءِ عَلٰٓى اَثَرِي وَعَجِلْتُ اِلَيْكَ رَبِّ لِتَرْضٰى ﴿٨٤﴾ قَالَ فَاِنَّا قَدْ فَتَنَّا قَوْمَكَ مِنْ بَعْدِكَ
وَاَضَلَّهُمُ السَّامِرِيُّ ﴿٨٥﴾ فَرَجَعَ مُوسٰٓى اِلٰى قَوْمِه۪ غَضْبَانَ اَسِفًاۚ قَالَ يَا قَوْمِ اَلَمْ يَعِدْكُمْ رَبُّكُمْ وَعْدًا
حَسَنًاۜ اَفَطَالَ عَلَيْكُمُ الْعَهْدُ اَمْ اَرَدْتُمْ اَنْ يَحِلَّ عَلَيْكُمْ غَضَبٌ مِنْ رَبِّكُمْ فَاَخْلَفْتُمْ مَوْعِدِي ﴿٨٦﴾ قَالُوا
مَٓا اَخْلَفْنَا مَوْعِدَكَ بِمَلْكِنَا وَلٰكِنَّا حُمِّلْنَٓا اَوْزَارًا مِنْ زِينَةِ الْقَوْمِ فَقَذَفْنَاهَا فَكَذٰلِكَ اَلْقَى السَّامِرِيُّ ﴿٨٧﴾

---

**84)** (قَالَ هُمْ اُولَٓاءِ عَلٰٓى اَثَرِي) – (Musa) **dedi:** (ey mənim rəbbim)**, onlar da dalımca gəlirlər.** (وَعَجِلْتُ اِلَيْكَ رَبِّ لِتَرْضٰى) – **ey mənim rəbbim, məndən razı qalmağın üçün hüzuruna tələsik gəldim.**

**85)** (قَالَ فَاِنَّا قَدْ فَتَنَّا قَوْمَكَ مِنْ بَعْدِكَ) **-** (Musa Allah-Təalaya dua edib, Allah-Təala da Tövratı ona nazil etdi və ondan sonra) **buyurdu:** (ey Musa)**, həqiqətən, sən** (bəni-İsraildən ayrılıb bura gələndən) **sonra qövmün** (bəni-İsraili fitnəyə salıb) **imtahan etdik.** (وَاَضَلَّهُمُ السَّامِرِيُّ) **- Samiri onları zəlalətə salıb** (onlardan ötrü qızıldan bir buzov düzəldib ona səcdə etdilər. Samirinin əsl adı Harun idi. Tövratda yazılan belədir ki, buzovu düzəldən Musanın qardaşı Harundur, amma Quranda bunun ziddidir)**.**

**86)** (فَرَجَعَ مُوسٰٓى اِلٰى قَوْمِه۪ غَضْبَانَ اَسِفًا) **- Musa qəzəb və təəssüflə** (Turdan bəni-İsrailin yanına) **qayıdıb** (onların buzova sitayiş etdiyini gördü)**.** (قَالَ يَا قَوْمِ اَلَمْ يَعِدْكُمْ رَبُّكُمْ وَعْدًا حَسَنًا) – (Musa) **dedi: "Ey mənim qövmüm,** (nə etdiniz?)**, bəs rəbbiniz Allah-Təala sizə** (Tövratı verəcəyəm deyə) **yaxşı və gözəl vəd vermədi?** (Budur, Allah-Təala Tövratı mənə bəxş etdi)**.** (اَفَطَالَ عَلَيْكُمُ الْعَهْدُ) **- yoxsa** (sizdən ayrı qalmağım) **uzun çəkdi, o səbəbdən mənə olan əhdinizdən döndünüz?** (Musa Tura gedəndə onlarla əhd etmişdi ki, Turdan qayıdıb gələnə kimi ona bağlı qalsınlar)**.** (اَمْ اَرَدْتُمْ اَنْ يَحِلَّ عَلَيْكُمْ غَضَبٌ مِنْ رَبِّكُمْ) – **yoxsa istəyirsiniz ki, rəbbiniz Allah-Təaladan sizə bir qəzəb** (və əzab) **nazil olub** (hamınızı həlak etsin?) (فَاَخْلَفْتُمْ مَوْعِدِي) **-** (pis iş görüb) **vədimə xilaf edib** (əhdinizdə sabit olmadınız)**."**

**87)** (قَالُوا مَٓا اَخْلَفْنَا مَوْعِدَكَ بِمَلْكِنَا) – (bəni-İsrail) **dedi: "**(ey Musa)**, öz ixtiyarımızla sənin vədinə xilaf çıxmadıq.** (وَلٰكِنَّا حُمِّلْنَٓا اَوْزَارًا مِنْ زِينَةِ الْقَوْمِ) **- lakin biz** (Misirdən çıxanda qibtilərin) **zinətlərindən ibarət ağır yüklər yüklənib** (gəlmişdik. Bəni-İsrail Misirdən çıxanda qibtilərdən qızıl zinətləri borc aldılar. O qızıllar bəni-İsraildə qaldı. O şəkildə də Misirdən çıxdılar)**.** (فَقَذَفْنَاهَا)– (Saminin təşviqi ilə o zinətləri bir çuxur yerə) **atdıq.** (فَكَذٰلِكَ اَلْقَى السَّامِرِيُّ) **- habelə bizim kimi Samiri özü də** (onda olan zinətləri, qızılları o yerə atdı. Bizə dedi ki, Musa qayıdıb gələnə kimi bu zinətlər burada qalsın. Ondan sonra Samiri o qızılları oradan çıxarıb, bir buzov heykəli düzəldib, bizə dedi ki, bu sizin ilahınızdır, buna ibadət edin)**."**

فَاَخْرَجَ لَهُمْ عِجْلًا جَسَدًا لَهُ خُوَارٌ فَقَالُوا هٰذَٓا اِلٰهُكُمْ وَاِلٰهُ مُوسٰى فَنَسِيَۜ ﴿٨٨﴾ اَفَلَا يَرَوْنَ اَلَّا يَرْجِعُ
اِلَيْهِمْ قَوْلًاۙ وَلَا يَمْلِكُ لَهُمْ ضَرًّا وَلَا نَفْعًا ﴿٨٩﴾ وَلَقَدْ قَالَ لَهُمْ هٰرُونُ مِنْ قَبْلُ يَا قَوْمِ اِنَّمَا فُتِنْتُمْ بِهٖۚ
وَاِنَّ رَبَّكُمُ الرَّحْمٰنُ فَاتَّبِعُونِي وَاَطِيعُٓوا اَمْرِي ﴿٩٠﴾ قَالُوا لَنْ نَبْرَحَ عَلَيْهِ عَاكِفِينَ حَتّٰى يَرْجِعَ اِلَيْنَا
مُوسٰى ﴿٩١﴾ قَالَ يَا هٰرُونُ مَا مَنَعَكَ اِذْ رَاَيْتَهُمْ ضَلُّوٓاۙ ﴿٩٢﴾ اَلَّا تَتَّبِعَنِۜ اَفَعَصَيْتَ اَمْرِي ﴿٩٣﴾

---

**88)** (فَاَخْرَجَ لَهُمْ عِجْلًا جَسَدًا لَهُ خُوَارٌ) – (Samiri bəni-İsraildən ötrü o qızıllardan) **böyürə bilən bir buzov heykəli düzəltdi.** (فَقَالُوا هٰذَٓا اِلٰهُكُمْ وَاِلٰهُ مُوسٰى) – (Samiri və onun davamçıları bəni-İsrailə) **dedilər: “Bu** (buzov) **sizin məbudunuz və Musanın məbududur.** (Buna səcdə edin)**.** (فَنَسِيَ) – (Musa bunu burada) **yadından çıxarıb** (gedib özünə məbud axtarır, Musanın bundan başqa məbudu yoxdur)**.**

**89)** (اَفَلَا يَرَوْنَ اَلَّا يَرْجِعُ اِلَيْهِمْ قَوْلًا) – (ey Məhəmməd, bəni-İsrail gör necə şüursuz camaat idi ki, buzova sitayiş edirdi)**, bəs dərk edib görmədilər ki,** (o buzov danışıb) **onlara cavab verə bilməz?** (وَلَا يَمْلِكُ لَهُمْ ضَرًّا وَلَا نَفْعًا) – **və onlara heç bir zərər və mənfəət verməyə qadir deyil.”** (Ağıllı şəxs də belə şeyə ibadət edər? Samiri buzov heykəlini elə ustalıqla düzəltmişdi ki, hər dəfə onu hərəkət etdirəndə deşiklərindən içinə hava girib buzov kimi böyürürdü. Bəni-İsrail də o buzova məftun olub onu çox sevdi)**.**

**90)** (وَلَقَدْ قَالَ لَهُمْ هٰرُونُ مِنْ قَبْلُ يَا قَوْمِ اِنَّمَا فُتِنْتُمْ بِهٖ) **- həqiqətən,** (Musa Turdan gəlmədən) **əvvəl Harun** (bəni-İsrailə) **dedi ki, ey camaat, həqiqətən, siz** (bu buzova sitayiş etməklə) **aldanıbsınız.** (Sizin məbudunuz bu deyil)**.** (وَاِنَّ رَبَّكُمُ الرَّحْمٰنُ) **- həqiqətən, sizin rəbbiniz Rəhman olan Allah-Təaladır.** (فَاتَّبِعُونِي وَاَطِيعُٓوا اَمْرِي) **- mənə tabe olub mənim əmrimə itaət edib** (bu buzova sitayiş etməyi tərk edin. Allah-Təalanın Harun barəsində verdiyi bu xəbər buzov heykəlini Musanın qardaşı Harunun düzəltdiyini söyləyən Tövratı təkzib edir)**.**

**91)** (قَالُوا لَنْ نَبْرَحَ عَلَيْهِ عَاكِفِينَ حَتّٰى يَرْجِعَ اِلَيْنَا مُوسٰى) – (bəni-İsrail Harunun cavabında) **dedi: “Musa qayıdıb bizim yanımıza gələnə qədər biz buzova ibadət etməyi tərk etməyib** (buna davam edəcəyik. Sonra Musa nə hökm etsə, ona tabe olarıq)**.**

**92-93)** (قَالَ يَا هٰرُونُ مَا مَنَعَكَ اِذْ رَاَيْتَهُمْ ضَلُّوا اَلَّا تَتَّبِعَنِ) – (Hz. Musa Turdan qayıdıb gələndə bəni-İsrailin buzovun ətrafında rəqs etdiklərini görüb qəzəblə Haruna) **dedi: “Ey Harun, bunların zəlalətə düşdüyünü görəndə sənə nə mane oldu ki, mənə tabe olmayıb** (onlara qəzəblənmədin? Bəni-İsraildən 12 min nəfərdən başqa, hər kəs buzova sitayiş etmişdi)**.** (اَفَعَصَيْتَ اَمْرِي) **- əmrimə asi olub itaətimdən çıxdın?”** (Musa Harunun saç və saqqalından tutub vurmağa başladı)**.**

قَالَ يَبْنَؤُمَّ لَا تَأْخُذْ بِلِحْيَتِي وَلَا بِرَأْسِيَۚ اِنِّي خَشِيتُ اَنْ تَقُولَ فَرَّقْتَ بَيْنَ بَنِي اِسْرَٓاءِيلَ وَلَمْ تَرْقُبْ
قَوْلِي ﴿٩٤﴾ قَالَ فَمَا خَطْبُكَ يَا سَامِرِيُّ ﴿٩٥﴾ قَالَ بَصُرْتُ بِمَا لَمْ يَبْصُرُوا بِه۪ فَقَبَضْتُ قَبْضَةً مِنْ
اَثَرِ الرَّسُولِ فَنَبَذْتُهَا وَكَذٰلِكَ سَوَّلَتْ لِي نَفْسِي ﴿٩٦﴾ قَالَ فَاذْهَبْ فَاِنَّ لَكَ فِي الْحَيٰوةِ اَنْ تَقُولَ لَا
مِسَاسَۖ وَاِنَّ لَكَ مَوْعِدًا لَنْ تُخْلَفَهُۚ وَانْظُرْ اِلٰى اِلٰهِكَ الَّذ۪ي ظَلْتَ عَلَيْهِ عَاكِفًاۜ

---

**94)** (قَالَ يَبْنَؤُمَّ لَا تَأْخُذْ بِلِحْيَتِي وَلَا بِرَأْسِي) – (Harun) **dedi: "Ey anamın oğlu,** (belə dedi ki, Musa ona rəhm etsin)**, saqqalımdan və başımın** (tükündən) **tutub** (məni rüsvay etmə). (اِنِّي خَشِيتُ اَنْ تَقُولَ فَرَّقْتَ بَيْنَ بَنِي اِسْرَٓاءِيلَ وَلَمْ تَرْقُبْ قَوْلِي) **- həqiqətən, mən sənin – niyə bəni-İsrailin arasına təfriqə salıb mənim sözümü gözləmədin?** (halbuki sənə onlara canişin olub xoş rəftar et, demişdim) **- deməyindən qorxdum",** (sənin bu vəsiyyətinə görə bir şey etmədim ki, gəlib özün əncam çəkəsən, bu fitnə-fəsadın baisi Samiridir)**.**

**95)** (قَالَ فَمَا خَطْبُكَ يَا سَامِرِيُّ) **-** (ondan sonra Hz. Musa Samiriyə dönüb) **dedi: "Ey Samiri, səni nə vadar etdi** (ki, heykəl düzəldib xalqı zəlalətə saldın?)"

**96)** (قَالَ بَصُرْتُ بِمَا لَمْ يَبْصُرُوا بِه۪) – (Samiri) **dedi: "Mən** (bəni-İsrailin) **görmədiyini** (firon qərq olanda bir at ləpiri) **gördüm,** (amma özünü görmədim. Bildim ki, o, Allah-Təala tərəfindən sənə göndərilən Cəbrayıldır)**.** (فَقَبَضْتُ قَبْضَةً مِنْ اَثَرِ الرَّسُولِ فَنَبَذْتُهَا) **– o elçinin** (atının) **ləpirindən bir ovuc** (torpaq) **götürdüm, onu** (buzovun ağzına) **tökdüm.** (O da dirilib böyürdü)**.** (وَكَذٰلِكَ سَوَّلَتْ لِي نَفْسِي)**- nəfsim bunu mənə gözəl göstərdi.** (Təfsirçilərə görə, o elçi Cəbrayıldır, Samiri onun atını görməsə də, atın ləpirini gördü, o yerdə ot göyərirdi. Samiri o torpaqdan bir qədər götürüb qızıldan düzəltdiyi buzovun içinə atdı, buzov dirilib böyürdü. Lakin ayəyə diqqət edəndə belə məlum olur ki, Samiri bu sözü Musadan üzr istəmək üçün deyir, amma bu söz doğrudur, yoxsa yox, məlum deyil. Nə Allah-Təala, nə də Hz. Musa bu sözü təsdiq etmir, əgər doğru olsaydı, bəlkə də, Musa onun təqsirindən keçərdi. Samiri Cəbrayılı ata mindirib, amma atı görməyib, Cəbrayılı və atı gördüyünü desəydi, daha məntiqli olardı. Ağıla və şəriətə zidd belə mənasız sözü Samirinin uydurduğunu qəbul etməliyik)**.**

**97)** (قَالَ فَاذْهَبْ فَاِنَّ لَكَ فِي الْحَيٰوةِ اَنْ تَقُولَ لَا مِسَاسَ) – (Hz. Musa Samirinin üzrxahlığını qəbul etməyib) **əmr etdi ki,** (bəni-İsrailin içindən) **çıx get. Ömrün olduqca** (kim səninlə danışmaq istəsə) **- mənə toxunmayın deyəcəksən.** (Əgər təsadüfən bir nəfər ona toxunsaydı, qızdırma xəstəliyinə tutulardı, bu səbəbdən Samiri vəhşi kimi səhralarda yaşayıb, biri ona yaxınlaşdıqda da qızdırma qorxusundan - mənə toxunmayın, deyirdi)**.** (وَاِنَّ لَكَ مَوْعِدًا لَنْ تُخْلَفَهُ) – (ey Samiri)**, bir də** (Allah-Təaladan) **sənin üçün heç qurtula bilməyəcəyin** (qiyamət əzabı) **vədi var.** (Allah-Təala sənə əzab edəcəkdir)**.** (وَانْظُرْ اِلٰى اِلٰهِكَ الَّذ۪ي ظَلْتَ عَلَيْهِ عَاكِفًا)

لَنُحَرِّقَنَّهُ ثُمَّ لَنَنْسِفَنَّهُ فِي الْيَمِّ نَسْفًا ﴿٩٧﴾ اِنَّمَا اِلٰهُكُمُ اللّٰهُ الَّذِي لَٓا اِلٰهَ اِلَّا هُوَ وَسِعَ كُلَّ شَيْءٍ عِلْمًا
﴿٩٨﴾ كَذٰلِكَ نَقُصُّ عَلَيْكَ مِنْ اَنْبَٓاءِ مَا قَدْ سَبَقَ وَقَدْ اٰتَيْنَاكَ مِنْ لَدُنَّا ذِكْرًا ﴿٩٩﴾ مَنْ اَعْرَضَ عَنْهُ
فَاِنَّهُ يَحْمِلُ يَوْمَ الْقِيٰمَةِ وِزْرًا ﴿١٠٠﴾ خَالِدِينَ فِيهِ وَسَٓاءَ لَهُمْ يَوْمَ الْقِيٰمَةِ حِمْلًا ﴿١٠١﴾ يَوْمَ يُنْفَخُ
فِي الصُّورِ وَنَحْشُرُ الْمُجْرِمِينَ يَوْمَئِذٍ زُرْقًا ﴿١٠٢﴾ يَتَخَافَتُونَ بَيْنَهُمْ اِنْ لَبِثْتُمْ اِلَّا عَشْرًا ﴿١٠٣﴾
نَحْنُ اَعْلَمُ بِمَا يَقُولُونَ اِذْ يَقُولُ اَمْثَلُهُمْ طَرِيقَةً اِنْ لَبِثْتُمْ اِلَّا يَوْمًا ﴿١٠٤﴾

---

– (ey Samiri), **ibadət etdiyin bu məbuduna** (buzova) **bax,** (لَنُحَرِّقَنَّهُ ثُمَّ لَنَنْسِفَنَّهُ فِي الْيَمِّ نَسْفًا) – (ey Samiri, diri zənn etdiyin bu buzovu) **yandırıb, sonra dənizə atacağıq** (ki, bir izi də qalmasın)**.**

**98)** (اِنَّمَا اِلٰهُكُمُ اللّٰهُ الَّذِي لَٓا اِلٰهَ اِلَّا هُوَ) – (ey bəni-İsrail, bu buzova ibadət etməyi tərk edin)**, həqiqətən, sizin** (haqq olan) **məbudunuz özündən başqa heç bir** (haqq) **məbud olmayan Allah-Təaladır,** (وَسِعَ كُلَّ شَيْءٍ عِلْمًا) – **elmi ilə hər şeyi əhatə etmişdir,** (heç bir şey onun elmindən kənar olmaz. Burada Musanın qissəsi bitdi. Bundan sonra Allah-Təala Hz. Peyğəmbərə xitab edir)**.**

**99)** (كَذٰلِكَ نَقُصُّ عَلَيْكَ مِنْ اَنْبَٓاءِ مَا قَدْ سَبَقَ) – (ey Məhəmməd, Musanın xəbəri kimi) **keçmiş xəbərlərdən sənə nəql edirik ki,** (dəlil və sübutın çox olsun. Eşidənlər ibrət alıb bəsirət sahibi olsunlar, müsəlmanlar dinlərində möhkəm olub, hələ müsəlman olmayanlar da müsəlman olsunlar)**.** (وَقَدْ اٰتَيْنَاكَ مِنْ لَدُنَّا ذِكْرًا) – (ey Məhəmməd)**, həqiqətən, sənə öz tərəfimizdən** (böyük) **zikr** (Quran) **vermişik.** (Təfəkkür edilməyə layiq olan ən yaxşı qissələr bu Qurandadır)**.**

**100)** (مَنْ اَعْرَضَ عَنْهُ فَاِنَّهُ يَحْمِلُ يَوْمَ الْقِيٰمَةِ وِزْرًا)- **kim** (Qurandan) **üz döndərib** (ona iman və əməl etməsə)**, həqiqətən, o şəxs qiyamət günündə ağır günah yüklənər.** (Bu səbəbdən əzaba düçar olar)**.**

**101)** (خَالِدِينَ فِيهِ وَسَٓاءَ لَهُمْ يَوْمَ الْقِيٰمَةِ حِمْلًا) - (Axirətdə əzab içində) **əbədi qalacaqlar. Qiyamət günü daşıdıqları yük necə də pisdir.**

**102)** (يَوْمَ يُنْفَخُ فِي الصُّورِ وَنَحْشُرُ الْمُجْرِمِينَ يَوْمَئِذٍ زُرْقًا) – **sura üflənən gün** (surətlərə ruh daxil olar)**, o gün günahkarları gözləri göyərmiş halda** (dirildib) **məhşərə toplayarıq.**

**103)** (يَتَخَافَتُونَ بَيْنَهُمْ اِنْ لَبِثْتُمْ اِلَّا عَشْرًا) – (qiyamət gününün) **qorxusundan bir-biriləri ilə gizlin danışıb deyərlər:** (dünyada) **ancaq 10 gün qaldınız.** (Heyif! Belə az vaxt üçün aldanıb qafil olmuşuq)**.**

**104)** (نَحْنُ اَعْلَمُ بِمَا يَقُولُونَ) – (ey Məhəmməd)**, onların** (qiyamət günü gizlin) **nə danışacaqlarını bilirik.** (اِذْ يَقُولُ اَمْثَلُهُمْ طَرِيقَةً اِنْ لَبِثْتُمْ اِلَّا يَوْمًا) – **onların ən ağıllısı –** (dünyada) **cəmi bir gün qalıbsınız deyər,** (yəni dünya ömrünüz axirətin

وَيَسْـَٔلُونَكَ عَنِ الْجِبَالِ فَقُلْ يَنْسِفُهَا رَبّ۪ي نَسْفًاۙ ﴿١٠٥﴾ فَيَذَرُهَا قَاعًا صَفْصَفًاۙ ﴿١٠٦﴾ لَا تَرٰى ف۪يهَا
عِوَجًا وَلَٓا اَمْتًا ﴿١٠٧﴾ يَوْمَئِذٍ يَتَّبِعُونَ الدَّاعِيَ لَا عِوَجَ لَهُۚ وَخَشَعَتِ الْاَصْوَاتُ لِلرَّحْمٰنِ فَلَا تَسْمَعُ
اِلَّا هَمْسًا ﴿١٠٨﴾ يَوْمَئِذٍ لَا تَنْفَعُ الشَّفَاعَةُ اِلَّا مَنْ اَذِنَ لَهُ الرَّحْمٰنُ وَرَضِيَ لَهُ قَوْلًا ﴿١٠٩﴾ يَعْلَمُ مَا
بَيْنَ اَيْد۪يهِمْ وَمَا خَلْفَهُمْ وَلَا يُح۪يطُونَ بِه۪ عِلْمًا ﴿١١٠﴾ وَعَنَتِ الْوُجُوهُ لِلْحَيِّ الْقَيُّومِۜ وَقَدْ خَابَ مَنْ
حَمَلَ ظُلْمًا ﴿١١١﴾ وَمَنْ يَعْمَلْ مِنَ الصَّالِحَاتِ وَهُوَ مُؤْمِنٌ فَلَا يَخَافُ ظُلْمًا وَلَا هَضْمًا ﴿١١٢﴾

---

müqabilində bir gün qədərdir. Axirətlə müqayisədə dünyada sürdükləri ömür onlara az göründüyündən, onu gah 10 gecə, gah da bir gün sayarlar**).**

**105)** (وَيَسْـَٔلُونَكَ عَنِ الْجِبَالِ) – (ey Məhəmməd)**, səndən** (qiyamət günü) **bu dağlar** (necə olacaq) **deyə soruşurlar.** (فَقُلْ يَنْسِفُهَا رَبّ۪ي نَسْفًا) **-** (ey Məhəmməd, onların cavabında) **de ki, mənim rəbbim** (o dağları qum kimi) **ovxalayıb** (göndərdiyi yellə) **havaya sovurar.**

**106)** (فَيَذَرُهَا قَاعًا صَفْصَفًا) – (ondan sonra Allah-Təala o dağların) **yerini düm-düz** (səth) **edər.**

**107)** (لَا تَرٰى ف۪يهَا عِوَجًا وَلَٓا اَمْتًا) – (ey Məhəmməd)**, o yerdə nə bir əyrilik, nə çuxur,** (nə də ucalıq) **görməzsən.** (Yəni qiyamət günü yerdə dərə-təpə olmaz)**.**

**108)** (يَوْمَئِذٍ يَتَّبِعُونَ الدَّاعِيَ لَا عِوَجَ لَهُ) – (bütün insanlar qiyamət) **günü** (Allah-Təala tərəfindən olan) **carçıya tabe olub ondan kənar ola bilməzlər.** (Onun dəvətilə hamısı məhşərə toplanar)**.** (وَخَشَعَتِ الْاَصْوَاتُ لِلرَّحْمٰنِ فَلَا تَسْمَعُ اِلَّا هَمْسًا) – (qiyamət günü) **Allah-Təalanın** (qorxusundan) **bütün səslər zəifləyər.** (ey Məhəmməd)**, pıçıltıdan başqa bir şey eşitməzsən.**

**109)** (يَوْمَئِذٍ لَا تَنْفَعُ الشَّفَاعَةُ اِلَّا مَنْ اَذِنَ لَهُ الرَّحْمٰنُ وَرَضِيَ لَهُ قَوْلًا) – (qiyamət) **günü Allah-Təalanın izin verdiyi və danışmasına razı olduğu şəxsdən başqa heç kimin şəfaəti fayda verməz.**

**110)** (يَعْلَمُ مَا بَيْنَ اَيْد۪يهِمْ وَمَا خَلْفَهُمْ وَلَا يُح۪يطُونَ بِه۪ عِلْمًا) – (Allah-Təala insanların) **keçmişini də, gələcəyini də bilir, amma onlar elmləri ilə Allah-Təalanı əhatə edə bilməzlər.**

**111)** (وَعَنَتِ الْوُجُوهُ لِلْحَيِّ الْقَيُّومِ) – (qiyamət günü) **asilərin üzləri əbədi və** (insanları) **idarə edən Allah-Təala qarşısında zəlil olar.** (وَقَدْ خَابَ مَنْ حَمَلَ ظُلْمًا) **- həqiqətən,** (dünyada) **zülm** (günahını) **yüklənib** (özü ilə axirətə aparan) **özünə zərər veribdir.** (Heç vaxt ondan xilas olmaz)**.**

**112)** (وَمَنْ يَعْمَلْ مِنَ الصَّالِحَاتِ وَهُوَ مُؤْمِنٌ) **– kim də** (Qurana iman gətirdiyi halda) **yaxşı və gözəl əməl etsə,** (فَلَا يَخَافُ ظُلْمًا وَلَا هَضْمًا) **- zülm** (əzab) **edilməkdən və** (savabının) **əskildilməsindən qorxmaz,** (əcr, savabı tam verilər)**.**

وَكَذٰلِكَ اَنْزَلْنَاهُ قُرْاٰنًا عَرَبِيًّا وَصَرَّفْنَا فِيهِ مِنَ الْوَعِيدِ لَعَلَّهُمْ يَتَّقُونَ اَوْ يُحْدِثُ لَهُمْ ذِكْرًا ﴿١١٣﴾ فَتَعَالَى اللّٰهُ
الْمَلِكُ الْحَقُّ وَلَا تَعْجَلْ بِالْقُرْاٰنِ مِنْ قَبْلِ اَنْ يُقْضٰى اِلَيْكَ وَحْيُهُۘ وَقُلْ رَبِّ زِدْنِي عِلْمًا ﴿١١٤﴾ وَلَقَدْ
عَهِدْنَٓا اِلٰٓى اٰدَمَ مِنْ قَبْلُ فَنَسِيَ وَلَمْ نَجِدْ لَهُ عَزْمًا۟ ﴿١١٥﴾ وَاِذْ قُلْنَا لِلْمَلٰٓئِكَةِ اسْجُدُوا لِاٰدَمَ فَسَجَدُٓوا اِلَّٓا
اِبْلِيسَۜ اَبٰى ﴿١١٦﴾ فَقُلْنَا يَٓا اٰدَمُ اِنَّ هٰذَا عَدُوٌّ لَكَ وَلِزَوْجِكَ فَلَا يُخْرِجَنَّكُمَا مِنَ الْجَنَّةِ فَتَشْقٰى ﴿١١٧﴾

---

**113)** (وَكَذٰلِكَ اَنْزَلْنَاهُ قُرْاٰنًا عَرَبِيًّا وَصَرَّفْنَا فِيهِ مِنَ الْوَعِيدِ) - (ey Məhəmməd, xalqı qorxutmaq üçün sənə bu surəni və bu ayələri göndərdiyimiz kimi)**, habelə bu Quranı da sənə ərəb dilində göndərib, əzab ayələrini təkrar-təkrar izah etdik** (لَعَلَّهُمْ يَتَّقُونَ اَوْ يُحْدِثُ لَهُمْ ذِكْرًا) – **ki,** (bu Quran) **səbəbinə** (şirk və günahdan) **çəkinib** (müvəhhid olsunlar)**, ya da** (Qurana itaət edib) **ibrət alıb** (nicat tapsınlar. Bu ikisindən birinə ümid edib onları qorxut)**.**

**114)** (فَتَعَالَى اللّٰهُ الْمَلِكُ الْحَقُّ) – (əbədi və) **həqiqi olan hökmdar** (Allah-Təala mülhid və müşriklərin sözlərindən) **ucadır.** (Heç nə, həyat və ölüm də onun qüdrətindən kənar ola bilməz)**.** (وَلَا تَعْجَلْ بِالْقُرْاٰنِ مِنْ قَبْلِ اَنْ يُقْضٰى اِلَيْكَ وَحْيُهُ) - (Hz. Peyğəmbərə vəhy gələndə sürətlə oxuyardı ki, birdən yadından çıxar. Allah-Təala bu ayədə peyğəmbərə sürətli oxumağı qadağan edib, aramla oxumağı tapşırır: ey Məhəmməd)**, vəhy bitmədən Quranı oxumağa tələsmə,** (səbir et, onu sənə əzbərlətmək bizim öhdəmizdədir. Qorxma, Qurandan bir hərfi də unutmazsan. Hz. Peyğəmbər Allah-Təalanın ədəbiylə ədəblənib, ümmətinə ədəb öyrətmək üçün belə deyibdir: "Tələsmək şeytandan, ehtiyatlı olmaq Rəhmandandır" (Acluni, Kəşful-Xafa, I/295))**.** (وَقُلْ رَبِّ زِدْنِي عِلْمًا) - (ey Məhəmməd, hər bir şeyin faydasını sənə öyrətdiyi üçün təvazö edib şükür et və belə) **de: "Ey mənim rəbbim, elmimi* artır."**

**115)** (وَلَقَدْ عَهِدْنَا اِلٰى اٰدَمَ مِنْ قَبْلُ فَنَسِيَ وَلَمْ نَجِدْ لَهُ عَزْمًا) – (insanlar Allah-Təalanın əmrinə müxalif olub onun itaətindən çıxmaqda, sanki, babaları Adəmə təqlid edirlər)**. Həqiqətən,** (sizdən) **qabaq Adəmə əhd etdik** (ki, o ağacın meyvəsindən yeməsin. Əhdimizə diqqət etməyib unudub yedi. Onu bizim əhdimizdə möhkəm görmədik. Şeytanın vəsvəsəsinə tabe olub bizim əhdimizi tərk etdi)**.**

**116)** (وَاِذْ قُلْنَا لِلْمَلٰٓئِكَةِ اسْجُدُوا لِاٰدَمَ فَسَجَدُٓوا اِلَّٓا اِبْلِيسَ اَبٰى) – **o zaman ki** (Adəmə ruh üfləndi) **mələklərə - ona səcdə edin, dedikdə,** (mələklər) **səcdə etdilər, ancaq iblis imtina edib** (Adəmə səcdə etmədi)**.**

**117)** (فَقُلْنَا يَا اٰدَمُ اِنَّ هٰذَا عَدُوٌّ لَكَ وَلِزَوْجِكَ فَلَا يُخْرِجَنَّكُمَا مِنَ الْجَنَّةِ فَتَشْقٰى) – (Adəmə) **dedik: "Ey Adəm, həqiqətən, bu** (şeytan) **sənin və arvadın** (Həvvanın) **düşmənidir. Elə olmasın ki, sizə vəsvəsə edib cənnətdən çıxartsın. Yoxsa** (güzəran keçirməkdə) **sıxıntı çəkərsən."**

إِنَّ لَكَ اَلَّا تَجُوعَ فِيهَا وَلَا تَعْرٰىۙ ﴿١١٨﴾ وَاَنَّكَ لَا تَظْمَؤُا فِيهَا وَلَا تَضْحٰى ﴿١١٩﴾

---

**118)** (إِنَّ لَكَ اَلَّا تَجُوعَ فِيهَا وَلَا تَعْرٰى) – (ey Adəm, cənnətdə səndən ötrü hər cür asudəlik var)**, nə** (yeməyə ehtiyacın olub) **ac qalmazsan, nə də** (libasa möhtac olub) **çılpaq qalmazsan,** (bütün ehtiyacların həll olunar)**.**

*(*Qeyd: Elmin şərəfinə bu kifayət edər ki, Allah-Təala öz peyğəmbərinə ancaq elm öyrənməsini xahiş etməsini əmr edir. Elm dünya və axirət səadətinin səbəbi olduğundan Allah-Təala da möhtərəm peyğəmbərinə bunu əmr edir. Bəs islam ümməti bu ayənin məzmununa əməl edib elm yolunda gedirlərmi? Allah-Təalanın vəhşi ərəblərin içindən Hz. Peyğəmbəri seçib göndərməsinin məqsədi də o cahilləri zəlalət vadisindən xilas edib nurlu elm aləminə daxil etmək idi. Vay müsəlmanların halına ki, hər kəlməsində dərin mənalar olan Qurani-Şərifin açıq-aşkar ayələrini tərk edib, xristianlar kimi uydurma xəbərlərə yapışıb, öz aralarında ixtilaf edib, yəhudilərin Allah-Təalanın kitabı Tövratı kənara qoyub, Məlaki adlı şəxsin təhrif etdiyi saxta Tövrata yapışması kimi, onlar da Qurani-Şərifin ehkamını unudub, özlərinə ayrı din, iman seçiblər. Yalan sözlər aramızda rəvac tapıb, xurafat ilə dolu kitablar camaat arasında Qurani-Şərifdən artıq hörmət gördüyündən cəhalət günbəgün artır. Hətta özlərini üləma sayanların əksəri zahirdə alim, batində cahil olub yalan sözləri yaymaqda daha çox canfəşanlıq edirlər. Məsələn, Hz. Mehdi haqqında kitablar yazıb, uydurduqları sözlərə etiqad edirlər. O cümlədən belə yazırlar ki, biri məşriqdə, o birisi məğribdə iki şəhər var, birinin adı Cabliqa, o birisinin adı Cablisadır, o şəhərlərdə Mehdiyə tabe olanlar və övladları var, həmişə ora gedib onların arasında qalıb onlara nəsihət və vəz edir. Soruşanda ki, bu şəhərlər haradadır ki, biz də onlara agah olaq? Cavab verirlər ki, haşa, Allah-Təalanın qüdrətini inkar edirsən? Necə ki Allah-Təala Mehdinin özünü qaib edib, habelə o şəhərləri də qaib etməyə qüdrəti var, bəs bunu da inkar edəcəksən ki, Mehdidən qabaq Dəccal gələcək, özünün də eşşəyi olub ona minəcək. O eşşəyin uzunluğu 30 fərsəx (hər fərsəx-4 mil) olacaqdır, bu eşşək indi Mazandaran cəngəlliyində Dəccalın gəlməsini gözləyir. Bu cahillərin yazdığına fikir verin, belə kitablarla müsəlmanlardan nə ümid etmək olar? Bir halda ki, müsəlmanlara hidayət edənlər belə mənasız sözlər yazıb nəşr edirlər, müsəlmanların belə hərc-mərclik içində qalıb cahil olmaları təəccüblü deyil... Nə coğrafiyadan, nə də həndəsədən xəbərləri olmadığı halda, adlarını alim qoyub, xəyallarında şəhərlər qurub, Dəccalın bu uzunluqda eşşəyinin olduğunu düşünənlərdən nə gözləmək olar? Camaatın əksəri cahil olub, uşaq vaxtlarından ata-analarından bir şey öyrənmədiklərindən belə sözləri cani-dildən qəbul edirlər. Sanki Allah-Təala Hz. Peyğəmbərə heç Quran göndərməmiş kimi o hökmləri tərk ediblər. Mən həqir hər dəfə belə şeyləri yazıb danışanda qəlbimi qəm-qüssə, hüzn basır, ürəyim yandığından yazıram, bu dərdin əlacı elm nurundan başqa bir şey deyil).*

**119)** (وَاَنَّكَ لَا تَظْمَؤُا فِيهَا وَلَا تَضْحٰى) - (ey Adəm)**, nə cənnətdə susuzluq çəkməzsən, nə də** (ağacların kölgəsi sayəsində) **günəşin hərarəti sənə təsir etməz.**

**فَوَسْوَسَ اِلَيْهِ الشَّيْطَانُ قَالَ يَٓا اٰدَمُ هَلْ اَدُلُّكَ عَلٰى شَجَرَةِ الْخُلْدِ وَمُلْكٍ لَا يَبْلٰى ﴿١٢٠﴾ فَاَكَلَا مِنْهَا فَبَدَتْ لَهُمَا سَوْاٰتُهُمَا وَطَفِقَا يَخْصِفَانِ عَلَيْهِمَا مِنْ وَرَقِ الْجَنَّةِۘ وَعَصٰٓى اٰدَمُ رَبَّهُ فَغَوٰىۖ ﴿١٢١﴾ ثُمَّ اجْتَبٰيهُ رَبُّهُ فَتَابَ عَلَيْهِ وَهَدٰى ﴿١٢٢﴾ قَالَ اهْبِطَا مِنْهَا جَمِيعًا بَعْضُكُمْ لِبَعْضٍ عَدُوٌّ**

---

**120)** (فَوَسْوَسَ اِلَيْهِ الشَّيْطَانُ) **-** (Allah-Təala Adəmə bu nəsihətləri edəndən sonra) **şeytan** (Adəmə) **vəsvəsə etdi.** (قَالَ يَٓا اٰدَمُ هَلْ اَدُلُّكَ عَلٰى شَجَرَةِ الْخُلْدِ وَمُلْكٍ لَا يَبْلٰى) – (vəsvəsə edib) **dedi: "Ey Adəm,** (həmişə cənnətdə qalıb, meyvəsindən yeyəcəyin) **əbədiyyət ağacını və heç vaxt fani olmayan mülkü sənə göstərimmi?"**

**121)** (فَاَكَلَا مِنْهَا فَبَدَتْ لَهُمَا سَوْاٰتُهُمَا) – (Adəm və Həvva şeytanın vəsvəsəsinə aldanıb qadağan olunan o ağacın meyvəsindən) **yedilər, ikisinin də ayıb yeri dərhal özlərinə göründü.** (Örtünmək üçün yer axtarmağa başladılar)**.** (وَطَفِقَا يَخْصِفَانِ عَلَيْهِمَا مِنْ وَرَقِ الْجَنَّةِ) – (tapmadıqları üçün) **cənnət ağaclarının yarpaqlarından özlərinə* yapışdırıb** (örtündülər)**.**

*(*Qeyd: Adəm və Həvva cənnətdə əvvəlcə libassız idilər, lakin cənnətdə yanlarında başqa insanlar olmadığından Allah-Təala bunun qəbahətini onlardan gizlətmişdi. Elə ki şeytana itaət edib qadağan olunan ağacın meyvəsindən yedilər, cənnətdən dünyaya göndəriləcəkləri məlum oldu. Allah-Təala da çılpaq olmanın qəbahətini onlara bildirdi. Ta ki dünyada onlardan meydana gələcək övladlarının arasında çılpaqlığın qəbahəti bilinsin və ayıb yerləri örtmə qanununa riayət edilsin. Qurani-Şərifdə olan qissələrin ehtiva etdiyi məna və faydalar sonsuzdur. Ağıllı şəxslər, gərək, diqqət etsinlər).*

(وَعَصٰٓى اٰدَمُ رَبَّهُ فَغَوٰى) **-** (Allah-Təala Adəmə nəsihət edib onu şeytanla qorxutsa da)**, Adəm rəbbi Allah-Təalaya asi* olub yolundan çıxdı.** (Bu Adəm əksər insanların əcdadıdır, insanlıq Allah-Təalaya asi olub itaətdən çıxmaqda sanki, o Adəmi təqlid edib asi olurlar)**.**

*(*Qeyd: Bu ayə insanları xəbərdar etməkdən ötrüdür, yəni diqqətlə fikir verib baxın, görün Adəm kimi insanlığın əcdadı olan peyğəmbərin haqqında Allah nə buyurur, onu necə asi adıyla yad edib günahkar sayır ki, ancaq tövbə edəndən sonra onun xətasını bağışlayıb güzəşt edir. Amma siz insanlar etdiyiniz böyük günahlara bəraət qazandırmaqdan ötrü Adəmin günahını ilk günah adlandırırsınız, Allahın sizi günahkar sayıb, sizinlə necə rəftar edəcəyini düşünün).*

**122)** (ثُمَّ اجْتَبٰيهُ رَبُّهُ فَتَابَ عَلَيْهِ وَهَدٰى) – (Adəm bu xətasından sonra tövbə etdiyi üçün) **rəbbi Allah-Təala da onu seçib tövbəsini qəbul etdi və** (tövbəsində möhkəm durub ismət və təqva yolunu qoruması üçün) **ona hidayət etdi.**

**123)** (قَالَ اهْبِطَا مِنْهَا جَمِيعًا بَعْضُكُمْ لِبَعْضٍ عَدُوٌّ) – (Adəm və Həvva insanlığın əcdadı olduğuna görə, Allah-Təala bu ayədə onlara cəm şəklində xitab edib)

فَاِمَّا يَأْتِيَنَّكُمْ مِنّ۪ي هُدًى فَمَنِ اتَّبَعَ هُدَايَ فَلَا يَضِلُّ وَلَا يَشْقٰى ﴿١٢٣﴾ وَمَنْ اَعْرَضَ عَنْ ذِكْر۪ي فَاِنَّ
لَهُ مَع۪يشَةً ضَنْكًا وَنَحْشُرُهُ يَوْمَ الْقِيٰمَةِ اَعْمٰى ﴿١٢٤﴾ قَالَ رَبِّ لِمَ حَشَرْتَن۪ٓي اَعْمٰى وَقَدْ كُنْتُ بَص۪يرًا
﴿١٢٥﴾ قَالَ كَذٰلِكَ اَتَتْكَ اٰيَاتُنَا فَنَس۪يتَهَاۚ وَكَذٰلِكَ الْيَوْمَ تُنْسٰى ﴿١٢٦﴾ وَكَذٰلِكَ نَجْز۪ي مَنْ اَسْرَفَ
وَلَمْ يُؤْمِنْ بِاٰيَاتِ رَبِّه۪ۜ وَلَعَذَابُ الْاٰخِرَةِ اَشَدُّ وَاَبْقٰى ﴿١٢٧﴾ اَفَلَمْ يَهْدِ لَهُمْ كَمْ اَهْلَكْنَا قَبْلَهُمْ مِنَ
الْقُرُونِ يَمْشُونَ ف۪ي مَسَاكِنِهِمْۜ اِنَّ ف۪ي ذٰلِكَ لَاٰيَاتٍ لِاُو۫لِي النُّهٰى ﴿١٢٨﴾

---

**buyurur: “Bir-birinizə düşmən olaraq hamınız** (yəni nəslinizdən olan övladlarınız da cənnətdən) **çıxıb** (yer üzündə sakin olun). (فَاِمَّا يَأْتِيَنَّكُمْ مِنّ۪ي هُدًى) **- əgər bundan sonra mənim tərəfimdən sizə hidayət edən** (bir peyğəmbər və kitab) **gəlsə,** (فَمَنِ اتَّبَعَ هُدَايَ فَلَا يَضِلُّ وَلَا يَشْقٰى) **– kim** (o kitab və peyğəmbərə) **tabe olub,** (mənə iman gətirsə, dünyada) **zəlalətə düşməyib,** (axirətdə də əzaba düçar olan) **asilərdən olmaz.**

**124)** (وَمَنْ اَعْرَضَ عَنْ ذِكْر۪ي فَاِنَّ لَهُ مَع۪يشَةً ضَنْكًا) **- amma kim mənim zikrimdən** (Quranımdan) **üz döndərib** (iman gətirməsə)**, həqiqətən, onun** (dünya) **həyatı dar olar,** (zahirdə bolluq içində olsa da, rahatlıq içində olmaz). (وَنَحْشُرُهُ يَوْمَ الْقِيٰمَةِ اَعْمٰى) **–** (bizim kitabımıza iman gətirməyən şəxsi) **qiyamət günü kor olaraq məhşərə gətirərik** (ki, məhşər əhlinin arasında heç bir tərəfə yol tapa bilməsin)**.**

**125)** (قَالَ رَبِّ لِمَ حَشَرْتَن۪ٓي اَعْمٰى وَقَدْ كُنْتُ بَص۪يرًا) **–** (məhşərə kor gətirilən şəxs) **deyər: “Ey mənim rəbbim, niyə məni məhşərə kor gətirdin? Halbuki mən görürdüm** (görən gözüm var idi)**.”**

**126)** (قَالَ كَذٰلِكَ اَتَتْكَ اٰيَاتُنَا فَنَس۪يتَهَا) **–** (Allah-Təala onun cavabında) **buyurur: “Belədir,** (sən də dünyada belə edibsən dünyada) **sənə açıq-aşkar dəlil və sübutlarımız gəldi. Sənsə onları yaddan çıxarıb** (etibar etməyib gözünü kor etdin). (وَكَذٰلِكَ الْيَوْمَ تُنْسٰى) **- habelə bu gün də sən unudulub,** (kor qalacaqsan)**.**

**127)** (وَكَذٰلِكَ نَجْز۪ي مَنْ اَسْرَفَ وَلَمْ يُؤْمِنْ بِاٰيَاتِ رَبِّه۪) **- habelə həddi aşanlara və öz rəbbi Allah-Təalanın ayələrinə iman gətirməyib** (ona şərik qoşanlara) **belə cəza verərik.** (وَلَعَذَابُ الْاٰخِرَةِ اَشَدُّ وَاَبْقٰى) **- əlbəttə, axirətin əzabı şiddətli və əbədidir.”**

**128)** (اَفَلَمْ يَهْدِ لَهُمْ كَمْ اَهْلَكْنَا قَبْلَهُمْ مِنَ الْقُرُونِ يَمْشُونَ ف۪ي مَسَاكِنِهِمْ) **-** (ey Məhəmməd)**, onlardan əvvəl** (Ad, Səmud camaatı kimi) **neçə-neçə nəsilləri həlak etməyimiz** (bu Qüreyş tayfasının) **hidayətə gəlib** (haqqa qovuşmalarına səbəb olmadı? Halbuki (hər dəfə Şama gedib gələndə) onların məskənlərində dolaşıb (izlərini görürlər, niyə onlardan ibrət almırlar?) (اِنَّ ف۪ي ذٰلِكَ لَاٰيَاتٍ لِاُو۫لِي النُّهٰى) **- həqiqətən, bunda ağıl sahiblərindən ötrü** (Allah-Təalanın tövhid və qüdrətinə dair) **dəlil və sübutlar vardır.**

وَلَوْلَا كَلِمَةٌ سَبَقَتْ مِنْ رَبِّكَ لَكَانَ لِزَامًا وَاَجَلٌ مُسَمًّىۜ ﴿١٢٩﴾ فَاصْبِرْ عَلٰى مَا يَقُولُونَ وَسَبِّحْ
بِحَمْدِ رَبِّكَ قَبْلَ طُلُوعِ الشَّمْسِ وَقَبْلَ غُرُوبِهَاۚ وَمِنْ اٰنَٓائِ الَّيْلِ فَسَبِّحْ وَاَطْرَافَ النَّهَارِ لَعَلَّكَ تَرْضٰى
﴿١٣٠﴾ وَلَا تَمُدَّنَّ عَيْنَيْكَ اِلٰى مَا مَتَّعْنَا بِهٖٓ اَزْوَاجًا مِنْهُمْ زَهْرَةَ الْحَيٰوةِ الدُّنْيَا لِنَفْتِنَهُمْ فِيهِۜ وَرِزْقُ رَبِّكَ
خَيْرٌ وَاَبْقٰى ﴿١٣١﴾ وَأْمُرْ اَهْلَكَ بِالصَّلٰوةِ وَاصْطَبِرْ عَلَيْهَاۜ

---

**129)** (وَلَوْلَا كَلِمَةٌ سَبَقَتْ مِنْ رَبِّكَ لَكَانَ لِزَامًا وَاَجَلٌ مُسَمًّى) - (ey Məhəmməd)**, əgər rəbbin Allah-Təaladan** (ümmətin əzabını təxirə salmaq haqqında) **əzəldən bir söz** (hökm) **və təyin edilən bir vaxt olmasaydı, əlbəttə lazım olan əzaba düçar olardılar,** (necə ki Ad və Səmud qövmünə edildi, amma Allah-Təala vədinə xilaf çıxmayıb onların əzabını qiyamət gününə qədər təxirə saldı)**.**

**130)** (فَاصْبِرْ عَلٰى مَا يَقُولُونَ) **-** (ey Məhəmməd, Qüreyş camaatının sənə etdiyi tənələrə və sənə əziyyət verən sözlər) **deməsinə səbir et.** (وَسَبِّحْ بِحَمْدِ رَبِّكَ قَبْلَ طُلُوعِ الشَّمْسِ وَقَبْلَ غُرُوبِهَا) – (ey Məhəmməd)**, günəş doğmadan əvvəl** (ən yaxşı vaxt olan sübh namazında) **və batmadan əvvəl** (duaların qəbul olunduğu ikindi namazında) **rəbbin Allah-Təalaya həmd-səna edib zikr et.** (وَمِنْ آنَٓائِ الَّيْلِ فَسَبِّحْ وَاَطْرَافَ النَّهَارِ) **- yenə gecənin bir qismində** (bəzi saatlarında) **və gündüzün ətrafında** (hər iki tərəfində, əvvəlində və axırında) **Allah-Təalanı zikr et.** (لَعَلَّكَ تَرْضٰى) – (bu vaxtlarda Allah-Təalanı zikr edib ümid et ki, Allah-Təalanın sənə verdiyi əcr və savabla qəlbin şad olub) **razı qalasan.**

**131)** (وَلَا تَمُدَّنَّ عَيْنَيْكَ اِلٰى مَا مَتَّعْنَا بِهٖٓ اَزْوَاجًا مِنْهُمْ) **-** (ey Məhəmməd, kafirlərdən) **bir qisminə ləzzət almaları üçün verdiyimiz şeylərə gözünü dikib baxma.** (زَهْرَةَ الْحَيٰوةِ الدُّنْيَا لِنَفْتِنَهُمْ فِيهِ) **- onlar** (kafirləri) **sınamaq, günahlarını artırıb əzaba salmaq üçün verdiyimiz dünya həyatının zinətidir.** (وَرِزْقُ رَبِّكَ خَيْرٌ وَاَبْقٰى) **-** (ey Məhəmməd)**, rəbbin Allah-Təalanın sənə verdiyi ruzi və nemət** (islam dini və peyğəmbərlik) **daha yaxşı və əbədidir,** (dünya var olduqca, əbədi qalacaqdır)**.**

**132)** (وَأْمُرْ اَهْلَكَ بِالصَّلٰوةِ وَاصْطَبِرْ عَلَيْهَا) **-** (ey Məhəmməd)**, əhlinə** (qövm və əqrəbalarına) **namaz qılmalarını əmr et, özün də** (namaz qılmaqda möhkəm olub) **səbirli ol.** (Hz. Peyğəmbər bu ayədən sonra, xüsusən, gecələr o qədər namaz qıldı ki, mübarək ayaqları şişdi (Buxari, Təhəccüd 6; Əhməd b. Hənbəl, Müsnəd, VI/115). Necə ki ədiblərin və fəsihlərin rəhbəri imam Abdullah ibn Səid əl-Misri əl-Busiri məşhur "Qəsideyi-bürdə"sində belə deyir:

ظَلَمْتُ سُنَّةَ مَنْ أَحْيَا الظَّلَامَ إِلَى
أَنْ اشْتَكَتْ قَدَمَاهُ الضُّرَّ مِنْ وَرَمِ

"Mən ayaqları şişincəyə qədər namaz qılaraq, gecələrini ibadətlə keçirən peyğəmbərin (əs.,) sünnəsinə tabe olmadım*" (Abidin Paşa, Qəsideyi-Bürdə Tərcümə və Şərhi, s. 39))**.**

لَا نَسْئَلُكَ رِزْقًاؕ نَحْنُ نَرْزُقُكَؕ وَالْعَاقِبَةُ لِلتَّقْوٰى ﴿١٣٢﴾ وَقَالُوا لَوْلَا يَأْتِينَا بِاٰيَةٍ مِنْ رَبِّهٖؕ اَوَلَمْ تَأْتِهِمْ
بَيِّنَةُ مَا فِي الصُّحُفِ الْاُولٰى ﴿١٣٣﴾ وَلَوْ اَنَّٓا اَهْلَكْنَاهُمْ بِعَذَابٍ مِنْ قَبْلِهٖ لَقَالُوا رَبَّنَا لَوْلَٓا اَرْسَلْتَ
اِلَيْنَا رَسُولًا فَنَتَّبِعَ اٰيَاتِكَ مِنْ قَبْلِ اَنْ نَذِلَّ وَنَخْزٰى ﴿١٣٤﴾ قُلْ كُلٌّ مُتَرَبِّصٌ فَتَرَبَّصُواۚ فَسَتَعْلَمُونَ مَنْ
اَصْحَابُ الصِّرَاطِ السَّوِيِّ وَمَنِ اهْتَدٰى ﴿١٣٥﴾

---

*(*Qeyd: Mənim ruhum sənin şişən ayaqlarına fəda olsun, ey peyğəmbər. Bu şair deyən kimi bundan daha böyük nə zülm olar ki, şəriətin əmr etdiyi namazı qılmaqdan mübarək ayaqların şişmişdi. Sənin ümmətin isə onu tərk edib, demək olar ki, namazın ancaq adı qalıb. Xüsusən, cümə namazı ki, Qurani-Şərifdə Allah-Təala onun barəsində təkidlə hökm edib, ey peyğəmbər, sən də onu qılmağı nə qədər təkid edibsən. İslam ümmətinin bir qismi onu tərk edib onu haram sayırlar, bir qismi isə ancaq zahirdə ona əməl edirlər. Ey peyğəmbər, islam ümmətinin arasında sənin qoyduğun qanunlardan bir iz qalmayıb, adını dindar qoyan şəxslərdə sənin yolundan heç bir şey yoxdur. Ey peyğəmbər, elə bir zəmanəyə gəlmişik ki, yalan sözlər rəvac tapıb, sahibləri əziz və möhtərəm olublar. Amma doğru deyənlər, Qurani-Şərifə və sənin yoluna bağlananların sözü qeyri-məqbul, özləri xor və zəlil , bəlkə, mülhid və zındıq adıyla adlanırlar).*

(لَا نَسْئَلُكَ رِزْقًا نَحْنُ نَرْزُقُكَ) - (ey Məhəmməd)**, səndən** (başqalarına vermən üçün) **ruzi istəmirik. Sənin özünə ruzi verən bizik,** (ancaq bizə yönəlib, zəngin müşriklərə baxma)**.** (وَالْعَاقِبَةُ لِلتَّقْوٰى) – (xeyirli) **axirət təqva əhli üçündür.**

**133)** (وَقَالُوا لَوْلَا يَأْتِينَا بِاٰيَةٍ مِنْ رَبِّهٖ) – (müşriklər adətləri üzrə küfr və inadlarından) **belə dedilər: "Niyə** (bu Məhəmməd) **bizə öz rəbbi Allah-Təaladan bir dəlil və möcüzə gətirmir, ki, onun haqq olduğu məlum olsun?"** (اَوَلَمْ تَأْتِهِمْ بَيِّنَةُ مَا فِي الصُّحُفِ الْاُولٰى) – (Allah-Təala onların cavabında buyurur:) **bəs** (möcüzə olan bu Qurani-Şərifdə) **əvvəlki kitablarda olan** (mətləblərin) **bəyanı və dəlil və sübutlar onlara gəlmədi?** (Yenə möcüzə istəyirlər?)

**134)** (وَلَوْ اَنَّٓا اَهْلَكْنَاهُمْ بِعَذَابٍ مِنْ قَبْلِهٖ) - (ey Məhəmməd)**, əgər biz** (bu müşriklərə Quran nazil olmadan əvvəl əzab göndərib) **həlak etsəydik,** (لَقَالُوا رَبَّنَا لَوْلَٓا اَرْسَلْتَ اِلَيْنَا رَسُولًا فَنَتَّبِعَ اٰيَاتِكَ مِنْ قَبْلِ اَنْ نَذِلَّ وَنَخْزٰى) **- əlbəttə,** (qiyamət günündə) **deyəcəklər: "Ey bizim rəbbimiz, nə üçün zəlil və rüsvay olmadan əvvəl bizə peyğəmbər göndərib** (bizi hidayət etmədin) **ki, sənin ayələrinə** (və peyğəmbərinə) **tabe olaydıq?"** (Müşriklər belə bir bəhanə gətirməsin deyə Allah-Təala buyurur: "Onlara peyğəmbər və kitab göndərdik ki, bəhanələri olmasın")**.**

**135)** (قُلْ كُلٌّ مُتَرَبِّصٌ فَتَرَبَّصُوا) – (müşriklər deyirdilər: "Görək nə vaxt bu Məhəmmədə bəla nazil olur ki, onun şərindən xilas olaq." Allah-Təala onların bu sözlərini rədd edib buyurur: "Ey Məhəmməd, müşriklərə) **de ki,** (bəla kimə nazil olacaq deyə) **hamı gözləyir,** (mən də gözləyirəm)**, siz də gözləyin,** (فَسَتَعْلَمُونَ مَنْ اَصْحَابُ الصِّرَاطِ السَّوِيِّ وَمَنِ اهْتَدٰى) **- əlbəttə,** (qiyamət günü) **kimin**

(bizim, yoxsa sizin) **haqq və düz yolun sahibi olduğunu və hidayət tapıb** (zəlalətdən qurtulduğunu) **bilərsiniz.”**

Allaha həmd və şükür olsun. Ta Ha surəsinin təfsiri bitdi. Nə gözəl ibrətamiz bir surədir. Hz. peyğəmbər buyurubdur: “Ta Ha surəsini kim oxusa, (mənalarını anlayıb əməl etsə), Allah-Təala ona mühacir və ənsarın savabı qədər savab bəxş edər” (Zəməxşəri, Kəşşaf, II/560). Yəni kim bu surəni oxuyub, elmin şərəfini anlasa, Allah onu mühacir və ənsarın savabına şərik edər. Hz. Peyğəmbər buyurubdur: “Üləmanın mürəkkəbi Allah-Təala yolunda şəhid olan şəxslərin qanından üstündür”. Din və millətə elmlə verilən mənfəət cihad edib şəhid olmaqla verilən mənfəətdən artıqdır. Yuxarıdakı hədisdə mühacir və ənsarın savabına şərik olanlardan məqsəd də elm sahibi olan şəxslərdir ki, elm səbəbilə din və məzhəbə xidmət edib tərəqqi etdirirlər.




## əl-ƏNBİYA SURƏSİ

21-ci surədir. Məkkədə nazil olub, 112 ayə,1167 kəlmə, 2890 hərfdir.

بِسْمِ اللّٰهِ الرَّحْمٰنِ الرَّحِيمِ. اِقْتَرَبَ لِلنَّاسِ حِسَابُهُمْ وَهُمْ فٖي غَفْلَةٍ مُعْرِضُونَۚ ﴿١﴾ مَا يَأْتٖيهِمْ مِنْ ذِكْرٍ مِنْ رَبِّهِمْ مُحْدَثٍ اِلَّا اسْتَمَعُوهُ وَهُمْ يَلْعَبُونَۙ ﴿٢﴾ لَاهِيَةً قُلُوبُهُمْۜ وَاَسَرُّوا النَّجْوَىۗ اَلَّذٖينَ ظَلَمُواۗ

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1)** (اِقْتَرَبَ لِلنَّاسِ حِسَابُهُمْ وَهُمْ فٖي غَفْلَةٍ مُعْرِضُونَ) – **insanların haqq-hesab verəcəyi gün** (qiyamət günü) **yaxınlaşdı, halbuki onlar** (Allah-Təaladan) **qafil olub** (Onu zikr etməkdən) **üz döndərirlər.** (Qiyamət günü bizə uzaq görünsə də, Allah-Təalaya görə, yaxındır və bu səbəbdən ayədə qiyamətin yaxınlığını xəbər verir)**.**

**2)** (مَا يَأْتٖيهِمْ مِنْ ذِكْرٍ مِنْ رَبِّهِمْ مُحْدَثٍ اِلَّا اسْتَمَعُوهُ وَهُمْ يَلْعَبُونَ) – (bu müşriklərə) **öz rəbləri Allah-Təaladan elə bir yeni** (Quran) **ayəsi gəlməz ki, istehza* edərək ona qulaq asmasınlar,** (amma ibrət almazlar)**.**

*(*Qeyd: Qurani-Şərifi oxumaqda məqsəd onunla ədəblənməkdir, nəinki sadəcə musiqisinə qulaq asıb, mənasından qafil olmaq. Ya da ayələrin uca məzmununa diqqət etməyib tez-tələsik oxuyub-qurtarmaqdan ötrü də deyil. Necə ki bizim bu dövrdə ölülərin üstündə Quran oxunanda bu şəkildə oxunur, mənasına diqqət edilməyib, hətta kəlmələrin düzgün tələffüzünə də cəhd edilməyib, tez-tələsik bitirməyə çalışırlar. Belə oxumaqdan onun səsini eşitməkdən başqa nə hasil olacaqdır? Ölü yiyələri də şad olurlar ki, öz meyitlərindən ötrü Quran oxutdurub, onun savabından nicat tapacaqlar. Rəzil insanların belə Quran oxuması ilə əcr və savab yox, şər və günah qazanırlar. Bəs uca peyğəmbərimiz Quranı ölülər üstündə və belə hörmətsiz şəkildə oxumağı əmr etmişdi? Yoxsa diri olduğu halda cəhalət xəstəliyindən ölən şəxslərə həyat vermək üçün, onları dünya və axirət xoşbəxtliyinə qovuşdurmaqdan ötrü oxumağı əmr etmişdi? Səbəb nədir ki, Qurani-Şərifə hörmət etməyi və onun ehkamına əməl edib ədəblənməyi biz müsəlmanlar tərk etmişik? Mən həqir də bu mətləbə çaşıb qalmışam. Guya islam ümmətinin təbiəti yalan və aldadıcı sözlərə, zillətə meyilli olub, nəfsə zidd olan haqq sözlərdən nifrət edirlər. Belə deyil, bəlkə batil və yalan sözlərə tabe olub Qurani-Şərifdən uzaq olmaq cəhalətə baisdir).*

**3)** (لَاهِيَةً قُلُوبُهُمْ) – (müşriklərin) **qəlbləri qafil olduğu halda** (Quranın gözəl ehkamlarından üz döndərirlər)**.** (وَاَسَرُّوا النَّجْوَى اَلَّذٖينَ ظَلَمُوا) - **zalım** (müşriklər bir-biriləri ilə) **pıçıldaşırlar** (ki, heç kim onlardan xəbərdar olmasın, amma

هَلْ هٰذَٓا اِلَّا بَشَرٌ مِثْلُكُمْۚ اَفَتَأْتُونَ السِّحْرَ وَاَنْتُمْ تُبْصِرُونَ ﴿٣﴾ قَالَ رَبّ۪ي يَعْلَمُ الْقَوْلَ فِي السَّمَٓاءِ وَالْاَرْضِۘ وَهُوَ السَّم۪يعُ الْعَل۪يمُ ﴿٤﴾ بَلْ قَالُٓوا اَضْغَاثُ اَحْلَامٍ بَلِ افْتَرٰيهُ بَلْ هُوَ شَاعِرٌۚ فَلْيَأْتِنَا بِاٰيَةٍ كَمَٓا اُرْسِلَ الْاَوَّلُونَ ﴿٥﴾ مَٓا اٰمَنَتْ قَبْلَهُمْ مِنْ قَرْيَةٍ اَهْلَكْنَاهَاۚ اَفَهُمْ يُؤْمِنُونَ ﴿٦﴾ وَمَٓا اَرْسَلْنَا قَبْلَكَ اِلَّا رِجَالًا نُوح۪ٓي اِلَيْهِمْ فَسْـَٔلُٓوا اَهْلَ الذِّكْرِ اِنْ كُنْتُمْ لَا تَعْلَمُونَ ﴿٧﴾

---

bilmirlər ki, Allah-Təala hər bir gizlin sözə də agahdır). (هَلْ هٰذَٓا اِلَّا بَشَرٌ مِثْلُكُمْ) – (gizlin danışdıqları sözləri bu idi: "Bu Məhəmməd deyir ki, peyğəmbərdir"), **bu da sizin kimi insandır,** (insan necə peyğəmbər olar? O, peyğəmbər deyil, bəlkə sehrbazdır). (اَفَتَأْتُونَ السِّحْرَ وَاَنْتُمْ تُبْصِرُونَ) – (sehrbaz olduğunu) **gördüyünüz halda yenə onun sehrinə tabe olub** (sözlərinə qulaq asırsınız?)

**4)** (قَالَ رَبّ۪ي يَعْلَمُ الْقَوْلَ فِي السَّمَٓاءِ وَالْاَرْضِ) - (Hz. Peyğəmbər müşriklərin cavabında) **dedi: "Mənim rəbbim Allah-Təala səmada və yerdə olan sözlərə agahdır,** (heç bir şey ona məxfi qalmaz, necə ki sizin bu gizlin danışmağınızı mənə məlum etdi). (وَهُوَ السَّم۪يعُ الْعَل۪يمُ) – (Allah-Təala müşriklərin sözlərini) **eşidib,** (əməllərinə də) **agahdır.**

**5)** (بَلْ قَالُٓوا اَضْغَاثُ اَحْلَامٍ) – (dəlil və sübut qarşısında aciz qalan şəxs hər dəfə mənasız bir iddia ortaya atdığı kimi, Məkkə müşrikləri də Quranın müqabilində aciz qaldıqları üçün əvvəlcə dedilər: "O, sehrbazdır." Ondan sonra o sözlərindən vaz keçib) **dedilər: "Yox,** (Məhəmməd sehrbaz deyil, Quran, onun sözləri etibarsız)**, batil yuxulardır."** (بَلِ افْتَرٰيهُ) – (yenə dedilər:) **yox,** (yuxu da deyil, Allah-Təalaya isnad etdiyi) **yalanlardır.** (بَلْ هُوَ شَاعِرٌ) – (ondan sonra dedilər:) **yox, o, şairdir,** (Quran da bir şeirdir). (فَلْيَأْتِنَا بِاٰيَةٍ كَمَٓا اُرْسِلَ الْاَوَّلُونَ) **- gərək** (Məhəmməd) **bizə bir möcüzə gətirsin. Necə ki ondan əvvəlki** (peyğəmbərlər) **gətiriblər.**

**6)** (مَٓا اٰمَنَتْ قَبْلَهُمْ مِنْ قَرْيَةٍ اَهْلَكْنَاهَا اَفَهُمْ يُؤْمِنُونَ) – (ey Məhəmməd, bu Məkkə əhli səndən möcüzə istəyirlər, onlardan qabaq keçən ümmətlərə və camaatlara da Allah-Təala tərəfindən peyğəmbər gəlib möcüzə gətirdikləri halda)**, heç bir məmləkətin** (əhli peyğəmbərlərə) **iman gətirmədilər, biz də onları həlak etdik,** (bu müşriklər) **iman gətirəcək?** (Əvvəlki qövmlər möcüzəyə inanmadığı kimi bunlar da inanmazlar. Bir halda ki, inanmırlar, biz də boş yerə onlara möcüzə göstərmərik).

**7)** (وَمَٓا اَرْسَلْنَا قَبْلَكَ اِلَّا رِجَالًا نُوح۪ي اِلَيْهِمْ) – (bu ayə müşriklərin - bəşərdən peyğəmbər olmaz, sözünü rədd edir. Allah buyurur: "ey Məhəmməd)**, səndən əvvəlki** (ümmətlərə də) **ancaq kişi peyğəmbər göndərib vəhy etmişik.** (Heç bir zaman mələklərdən peyğəmbər göndərməmişik). (فَسْـَٔلُوا اَهْلَ الذِّكْرِ اِنْ كُنْتُمْ لَا تَعْلَمُونَ) – (ey Qüreyş camaatı)**, əgər bilmirsinizsə, kitab əhlindən soruşun,** (onlar sizə bildirərlər. Məkkə müşrikləri Mədinədə yaşayan kitab əhlinin yanı-

وَمَا جَعَلْنَاهُمْ جَسَدًا لَا يَأْكُلُونَ الطَّعَامَ وَمَا كَانُوا خَالِدِينَ ﴿٨﴾ ثُمَّ صَدَقْنَاهُمُ الْوَعْدَ فَاَنْجَيْنَاهُمْ
وَمَنْ نَشَٓاءُ وَاَهْلَكْنَا الْمُسْرِفِينَ ﴿٩﴾ لَقَدْ اَنْزَلْنَٓا اِلَيْكُمْ كِتَابًا فِيهِ ذِكْرُكُمْ اَفَلَا تَعْقِلُونَ ﴿١٠﴾ وَكَمْ
قَصَمْنَا مِنْ قَرْيَةٍ كَانَتْ ظَالِمَةً وَاَنْشَأْنَا بَعْدَهَا قَوْمًا اٰخَرِينَ ﴿١١﴾ فَلَمَّٓا اَحَسُّوا بَأْسَنَٓا اِذَا هُمْ مِنْهَا
يَرْكُضُونَ ﴿١٢﴾ لَا تَرْكُضُوا وَارْجِعُوٓا اِلٰى مَٓا اُتْرِفْتُمْ فِيهِ وَمَسَاكِنِكُمْ لَعَلَّكُمْ تُسْـَٔلُونَ ﴿١٣﴾

---

na gedib onlar ilə Hz. Peyğəmbəri dəf etmək haqqında məşvərət etdikləri üçün Allah-Təala bu işin həqiqətini onlardan soruşmağı əmr edir).

**8)** (وَمَا جَعَلْنَاهُمْ جَسَدًا لَا يَأْكُلُونَ الطَّعَامَ) – (o peyğəmbərləri) **yemək yeməyən bədən** (sahibi) **etməmişdik** (ki, Hz. Məhəmmədin də onlar kimi olmasını istəyəsiniz). (وَمَا كَانُوا خَالِدِينَ) – (zənn etdiyiniz kimi mələklər kimi də olmayıb ölümsüz)**, əbədi də deyildirlər.** (Necə ki siz müşriklər mələkləri ölümsüz zənn edirsiniz. Keçmiş peyğəmbərlər belə deyil ki, Hz. Məhəmməd də belə olsun. Hər bir peyğəmbər digər insanlar kimi dünyaya gəlib, bir qədər ömür sürüb, əcəlləri gələndə ölüblər).

**9)** (ثُمَّ صَدَقْنَاهُمُ الْوَعْدَ فَاَنْجَيْنَاهُمْ وَمَنْ نَشَٓاءُ) – (hər bir ümmətə peyğəmbər göndərib insanları dəvət edib) **sonra** (peyğəmbərlərə verdiyimiz - itaət etməsələr, əzab göndərib həlak edəcəyik) **vədinə sadiq qalıb** (peyğəmbərlərə) **və istədiyimiz şəxslərə** (möminlərə əzabdan) **nicat verdik.** (وَاَهْلَكْنَا الْمُسْرِفِينَ) – **həddi aşan** (müşrikləri isə) **həlak etdik.** (Siz müşriklər də qorxun ki, əgər itaət etməyib Qurana iman gətirməsəniz, sizə də əzab göndərib hamınızı həlak edərəm).

**10)** (لَقَدْ اَنْزَلْنَٓا اِلَيْكُمْ كِتَابًا فِيهِ ذِكْرُكُمْ) – (ey Qüreyş camaatı)**, həqiqətən, sizə elə bir kitab** (Quran) **göndərmişik ki, onda sizin üçün böyük iftixar, şərəf və ucalıq vardır.** (اَفَلَا تَعْقِلُونَ) **- bəs dərk edib anlamırsınız?** (Hz. Məhəmmədin sizdən olub sizə kitab gətirməsi sizin üçün nə qədər böyük dəyərdir).

**11)** (وَكَمْ قَصَمْنَا مِنْ قَرْيَةٍ كَانَتْ ظَالِمَةً وَاَنْشَأْنَا بَعْدَهَا قَوْمًا اٰخَرِينَ) – (ey Məhəmməd)**, biz zalım olan neçə məmləkət** (əhlini) **həlak edib, ondan sonra başqa qövmlər yaradıb** (onların yerində sakin etmişik).

**12)** (فَلَمَّٓا اَحَسُّوا بَأْسَنَٓا اِذَا هُمْ مِنْهَا يَرْكُضُونَ) – (o ümmətlər) **əzabımızı hiss edən kimi, qəfildən** (yurdlarını qoyub, miniklərinə minib sürətlə) **qaçmağa başladılar** (ki, bəlkə əzabdan xilas olsunlar).

**13)** (لَا تَرْكُضُوا وَارْجِعُوٓا اِلٰى مَٓا اُتْرِفْتُمْ فِيهِ وَمَسَاكِنِكُمْ) – (o vaxt da bizim tərəfimizdən sözlə yox, hal dili ilə onlara belə deyildi:) **qaçmayın, içində xoş güzəran keçirib** (tüğyan etdiyiniz) **məskənlərinizə qayıdın,** (niyə o nemətləri qoyub qaçırsınız?). (لَعَلَّكُمْ تُسْـَٔلُونَ) – (qaçmayın, gəlib yurtlarınızda oturun)**, bəlkə sizdən soruşarlar** (ki, yurdunuza, malınıza nə oldu? O vaxt da elmi üzrə onlara cavab verərsiniz. Bu söz həlak olanlara istehza üçün deyilir, çünki onların o

قَالُوا يَا وَيْلَنَآ اِنَّا كُنَّا ظَالِمِينَ ﴿١٤﴾ فَمَا زَالَتْ تِلْكَ دَعْوٰيهُمْ حَتّٰى جَعَلْنَاهُمْ حَصِيدًا خَامِدِينَ ﴿١٥﴾
وَمَا خَلَقْنَا السَّمَآءَ وَالْاَرْضَ وَمَا بَيْنَهُمَا لَاعِبِينَ ﴿١٦﴾ لَوْ اَرَدْنَآ اَنْ نَتَّخِذَ لَهْوًا لَاتَّخَذْنَاهُ مِنْ لَدُنَّا اِنْ
كُنَّا فَاعِلِينَ ﴿١٧﴾ بَلْ نَقْذِفُ بِالْحَقِّ عَلَى الْبَاطِلِ فَيَدْمَغُهُ فَاِذَا هُوَ زَاهِقٌ وَلَكُمُ الْوَيْلُ مِمَّا تَصِفُونَ
﴿١٨﴾ وَلَهُ مَنْ فِي السَّمٰوَاتِ وَالْاَرْضِ وَمَنْ عِنْدَهُ لَا يَسْتَكْبِرُونَ عَنْ عِبَادَتِهِ وَلَا يَسْتَحْسِرُونَ ﴿١٩﴾
يُسَبِّحُونَ الَّيْلَ وَالنَّهَارَ لَا يَفْتُرُونَ ﴿٢٠﴾

---

yurdlarına gəlib sağ qalmaqları mümkün deyildi ki, sual verənlərə də cavab versinlər)**.**

**14)** (قَالُوا يَا وَيْلَنَا اِنَّا كُنَّا ظَالِمِينَ) – (kafir və zalımlar görəndə ki, əzabdan qurtulmaları mümkün deyil)**, dedilər: "Vay halımıza, həqiqətən, biz zalım olub** (Allah-Təalaya şərik qoşmuşduq)**."**

**15)** (فَمَا زَالَتْ تِلْكَ دَعْوٰيهُمْ حَتّٰى جَعَلْنَاهُمْ حَصِيدًا خَامِدِينَ) – **biz onları əkin kimi biçib** (yox edənə) **qədər o zalımların** (vay halımıza) **fəryadları davam etdi.**

**16)** (وَمَا خَلَقْنَا السَّمَآءَ وَالْاَرْضَ وَمَا بَيْنَهُمَا لَاعِبِينَ) - (ey Məhəmməd)**, səmanı, yeri və onların arasında olan şeyləri oyun olsun deyə** (boş yerə) **yaratmadıq,** (necə ki dünyada padşahlar əyləncə və nəfsani istəklər üçün gözəl imarətlər, naxışlı, rəsmli saraylar tikdirib, gözəl səyahətlər edirlər. Biz buna görə yox, dini, ilahi hikmətlər, hökmlər və dünyəvi mənfəətlər üçün onları yaratmışıq)**.**

**17)** (لَوْ اَرَدْنَا اَنْ نَتَّخِذَ لَهْوًا لَاتَّخَذْنَاهُ مِنْ لَدُنَّا اِنْ كُنَّا فَاعِلِينَ) - (ey Məhəmməd)**, əgər biz əyləncə etmək istəsəydik, onu mütləq öz dərgahımızdan edərdik.** (Bu bizdən ötrü çox asandır. Lakin hər şeyi hikmət üzrə yaratdığımızdan hikmətsiz şey) **etmərik.**

**18)** (بَلْ نَقْذِفُ بِالْحَقِّ عَلَى الْبَاطِلِ فَيَدْمَغُهُ) - (ey Məhəmməd, bizim zatımız əyləncə və boş iş görməkdən pak və müqəddəsdir)**. Bəlkə** (bizim hikmətimizin şərti odur ki,) **haqla batili vurub onu parça-parça edək.** (فَاِذَا هُوَ زَاهِقٌ وَلَكُمُ الْوَيْلُ مِمَّا تَصِفُونَ) – (haqq batilə dəyib dağıtdıqda isə) **batil yox olar,** (Allah-Təalanı layiq olmadığı sifətlərlə, guya əyləncə üçün məxluqatı yaratmış deyə) **vəsf etdiyiniz üçün vay halınıza,** (siz müşriklərə əzab var)**.**

**19)** (وَلَهُ مَنْ فِي السَّمٰوَاتِ وَالْاَرْضِ وَمَنْ عِنْدَهُ) **- səmalarda və yerdə olan hər şey və Onun yanında olan** (mələklərin hamısı) **Onundur,** (Allah-Təalanın qulamıdır)**.** (لَا يَسْتَكْبِرُونَ عَنْ عِبَادَتِهِ وَلَا يَسْتَحْسِرُونَ) – (o mələklər) **Allah-Təalaya ibadət etməkdə təkəbbürlənməz,** (ibadət etməkdən) **yorulmazlar.**

**20)** (يُسَبِّحُونَ الَّيْلَ وَالنَّهَارَ لَا يَفْتُرُونَ) – (o mələklər) **gecə-gündüz yorulmadan Allah-Təalanı zikr edib,** (onu tərk etməzlər)**.**

اَمِ اتَّخَذُوٓا اٰلِهَةً مِنَ الْاَرْضِ هُمْ يُنْشِرُونَ ﴿٢١﴾ لَوْ كَانَ فِيهِمَٓا اٰلِهَةٌ اِلَّا اللّٰهُ لَفَسَدَتَاۚ فَسُبْحَانَ اللّٰهِ رَبِّ
الْعَرْشِ عَمَّا يَصِفُونَ ﴿٢٢﴾ لَا يُسْـَٔلُ عَمَّا يَفْعَلُ وَهُمْ يُسْـَٔلُونَ ﴿٢٣﴾

---

**21)** (اَمِ اتَّخَذُوا اٰلِهَةً مِنَ الْاَرْضِ هُمْ يُنْشِرُونَ) **- bəlkə** (müşriklər Allah-Təalaya əbəs əməlləri isnad etməkdən əlavə) **yerdən özlərindən ötrü məbudlar qəbul etdilər ki, onları dirildib** (məhşərə gətirsin? Yəni o bütlər ki, müşriklər onlara sitayiş edir, gərək, onları da dirildib məhşərə gətirməyə qadir olsunlar, halbuki onlarda o qüdrət yoxdur. Ölünü necə dirildə bilər, bununla belə müşriklər onlara sitayiş edib Allah-Təalaya şərik qoşurlar. Hz. Peyğəmbər bir dəfə bir kənizdən soruşdu ki, "Sənin rəbbin, məbudun haradadır? "O kəniz səmaya işarə etdi, Hz. Peyğəmbər buyurdu: "Bu kəniz mömindir." Hz. Peyğəmbərin o kənizi mömin saymasının səbəbi odur ki, o kəniz səmanı göstərməklə oranı Allah-Təalanın məkanı saymayıb, bəlkə, yer üzündə olan məbudları və bütləri yox sayıb, ancaq yeganə olan Allah-Təalanın haqq məbud olduğunu göstərmək istəmişdi)**.**

**22)** (لَوْ كَانَ فِيهِمَا اٰلِهَةٌ اِلَّا اللّٰهُ لَفَسَدَتَا) **-** (ey Məhəmməd)**, əgər yerdə və səmalarda onları idarə edən yeganə Allah-Təaladan başqa müxtəlif məbudlar olsaydı,** (hərəsi bir şey istəyəcəyindən) **hər halda ikisi də fəsada uğrayıb** (dağılardı. Necə ki bir məmləkətdə iki hökmdar olsa, o məmləkət dağılıb, yox olar. Əbdülməlik ibn Mərvanın yoldaşlarından olan Əmr ibn Səid (əl-Əşdaq) Əbdülməlikə qarşı çıxıb xəlifəlik iddiası etdi. Aralarında savaş olub Əbdülməlik ona qalib gəldi və onu tutub qətlə yetirdi. Onu öldürməyinə təəssüf edib dedi: "And olsun Allah-Təalaya, bu şəxs mənə gözümdən də əziz idi, lakin iki erkək dəvənin bir dişi dəvəyə sahib olması mümkün deyil." Bir məmləkətdə iki sultan olsa, ora məhv olar. Aləmdə iki eyni bərabər yaradıcı ola bilməz. Birində qüsur olsa, ona xaliq demək olmaz, məxluq sayılar. Bu səbəbdən cəmi aləmlərin yeganə yaradıcısı və idarəçisi Allah-Təaladır)**.** (فَسُبْحَانَ اللّٰهِ رَبِّ الْعَرْشِ عَمَّا يَصِفُونَ) **- uca ərşin Allahı** (müşriklərin Onu) **vəsf etdiyi** (sifətlərdən) **pak və müqəddəsdir.**

**23)** (لَا يُسْـَٔلُ عَمَّا يَفْعَلُ وَهُمْ يُسْـَٔلُونَ) – (Allah-Təalanın hər bir feli hikmət və məsləhət üzrə olduğundan) **etdiklərindən* sual sorulmaz,** (amma məxluqatın əməlində xəta vaqe olduğundan, Allah-Təala onların əməlini) **sorğu-sual edib** (hər kəsə öz əməlinə göə qarşılıq verər)**.**

*(***Qeyd:** Dünyada hökmdarların adəti belədir ki, xəta da etsələr, sorğu-sual olunmazlar, hansı ki bu mətləb zülm və istibdada dəlildir, belə olan vaxtda yeganə həqiqi hökmdar olan Allah-Təalanın hikmətli əməlləri də gərək sorğu-sual olunmasın. Kim Allah-Təaladan şikayət edirsə, o şəxs həqiqətən cahil olub böyük xətaya düşübdür. Gərək, hər kəs qədərə razı olub, qismətinə şükür edib, şikayət etməkdən dilini qorusun. İnsanın salamatlığı dilinə sahib olmasındadır).*

اَمِ اتَّخَذُوا مِنْ دُونِهٖٓ اٰلِهَةًۜ قُلْ هَاتُوا بُرْهَانَكُمْۚ هٰذَا ذِكْرُ مَنْ مَعِيَ وَذِكْرُ مَنْ قَبْلٖيۜ بَلْ اَكْثَرُهُمْ لَا يَعْلَمُونَۙ الْحَقَّ فَهُمْ مُعْرِضُونَ ﴿٢٤﴾ وَمَٓا اَرْسَلْنَا مِنْ قَبْلِكَ مِنْ رَسُولٍ اِلَّا نُوحٖٓي اِلَيْهِ اَنَّهُ لَٓا اِلٰهَ اِلَّٓا اَنَا فَاعْبُدُونِ ﴿٢٥﴾ وَقَالُوا اتَّخَذَ الرَّحْمٰنُ وَلَدًا سُبْحَانَهُۜ بَلْ عِبَادٌ مُكْرَمُونَۙ ﴿٢٦﴾ لَا يَسْبِقُونَهُ بِالْقَوْلِ وَهُمْ بِاَمْرِهٖ يَعْمَلُونَ ﴿٢٧﴾ يَعْلَمُ مَا بَيْنَ اَيْدٖيهِمْ وَمَا خَلْفَهُمْ وَلَا يَشْفَعُونَۙ اِلَّا لِمَنِ ارْتَضٰى وَهُمْ مِنْ خَشْيَتِهٖ مُشْفِقُونَ ﴿٢٨﴾ وَمَنْ يَقُلْ مِنْهُمْ اِنّٖٓي اِلٰهٌ مِنْ دُونِهٖ فَذٰلِكَ نَجْزٖيهِ جَهَنَّمَۜ

---

**24)** (اَمِ اتَّخَذُوا مِنْ دُونِهٖٓ اٰلِهَةً قُلْ هَاتُوا بُرْهَانَكُمْ) – (müşriklər bu dəlil və sübutlara fikir verməyib, özlərinə) **Allah-Təaladan başqa məbudlar qəbul etdilər?** (Ey Məhəmməd, onlara) **de ki,** (əgər Allah-Təalanın şəriki olduğunu deyirsinizsə)**, sübutunuzu gətirin,** (dəlilsiz söz qəbul olunmaz. Bir halda ki, sübutunuz yoxdur, iddianız batil və etibarsızdır)**.** (هٰذَا ذِكْرُ مَنْ مَعِيَ وَذِكْرُ مَنْ قَبْلٖي) - (ey Məhəmməd, de ki,) **bu mənimlə bərabər olanların** (şirki qadağan edib tövhidi isbat edən Quran) **kitabı və bu da bundan əvvəlki** (peyğəmbərlərə nazil olan) **kitab** (öyüd-nəsihət)**,** (بَلْ اَكْثَرُهُمْ لَا يَعْلَمُونَ الْحَقَّ فَهُمْ مُعْرِضُونَ) – **lakin insanların çoxu haqqdan agah olmayıb,** (cəhalətlərindən küfr və inad içində qalıb)**, Allah-Təalanın** (öyüd-nəsihətindən) **üz döndəriblər.**

**25)** (وَمَٓا اَرْسَلْنَا مِنْ قَبْلِكَ مِنْ رَسُولٍ اِلَّا نُوحٖي اِلَيْهِ اَنَّهُ لَٓا اِلٰهَ اِلَّٓا اَنَا فَاعْبُدُونِ) - (ey Məhəmməd)**, səndən əvvəl elə bir peyğəmbər göndərməmişik ki, ona – Məndən başqa heç bir** (haqq) **məbud yoxdur, ancaq Mənə ibadət edib** (şərik qoşmayın)**, deyib vəhy etməyək.**

**26)** (وَقَالُوا اتَّخَذَ الرَّحْمٰنُ وَلَدًا) - (Xüzaə qəbiləsi) **dedi: “Allah-Təala** (mələkləri) **özünə övlad götürübdür.** (سُبْحَانَهُ بَلْ عِبَادٌ مُكْرَمُونَ) – **xeyr,** (elə deyil, batil sözlər deyirlər, mələklər digər bəndələrdən fəzilətli olan) **möhtərəm qullardır.**

**27)** (لَا يَسْبِقُونَهُ بِالْقَوْلِ وَهُمْ بِاَمْرِهٖ يَعْمَلُونَ) - (mələklər həmişə Allah-Təalanın əmrinə tabe olub) **Ondan əvvəl söz deməzlər, ancaq Onun əmri ilə iş görüb** (Allah-Təalanın əmrindən çıxmazlar)**.**

**28)** (يَعْلَمُ مَا بَيْنَ اَيْدٖيهِمْ وَمَا خَلْفَهُمْ) – (Allah-Təala mələklərin) **önündəkilərə də, arxasındakılara da** (etdikləri və edəcəkləri əməllərə) **agahdır,** (əməllərinə görə, onlara qarşılıq verəcəkdir)**.** (وَلَا يَشْفَعُونَ اِلَّا لِمَنِ ارْتَضٰى) - (mələklər Allah-Təalanın) **razı olmadığı şəxsdən başqasına şəfaət etməzlər.** (وَهُمْ مِنْ خَشْيَتِهٖ مُشْفِقُونَ) – (bununla belə yenə) **Allah-Təalanın heybətindən qorxub** (xatircəm olmazlar)**.**

**29)** (وَمَنْ يَقُلْ مِنْهُمْ اِنّٖي اِلٰهٌ مِنْ دُونِهٖ) – (hərçənd mələklərdən Allah-Təalaya şərik qoşan olmaz, amma mələklərdən) **kimsə - Allah-Təaladan başqa haqq məbud mənəm, desə,** (فَذٰلِكَ نَجْزٖيهِ جَهَنَّمَ) **- ona cəhənnəm oduyla** (əzab verib) **cə-**

كَذٰلِكَ نَجْزِي الظَّالِمِينَ ﴿٢٩﴾ اَوَلَمْ يَرَ الَّذِينَ كَفَرُوٓا اَنَّ السَّمٰوَاتِ وَالْاَرْضَ كَانَتَا رَتْقًا فَفَتَقْنَاهُمَا
وَجَعَلْنَا مِنَ الْمَآءِ كُلَّ شَيْءٍ حَيٍّ اَفَلَا يُؤْمِنُونَ ﴿٣٠﴾ وَجَعَلْنَا فِي الْاَرْضِ رَوَاسِيَ اَنْ تَمِيدَ بِهِمْ
وَجَعَلْنَا فِيهَا فِجَاجًا سُبُلًا لَعَلَّهُمْ يَهْتَدُونَ ﴿٣١﴾ وَجَعَلْنَا السَّمَآءَ سَقْفًا مَحْفُوظًا وَهُمْ عَنْ اٰيَاتِهَا
مُعْرِضُونَ ﴿٣٢﴾ وَهُوَ الَّذِي خَلَقَ الَّيْلَ وَالنَّهَارَ وَالشَّمْسَ وَالْقَمَرَ كُلٌّ فِي فَلَكٍ يَسْبَحُونَ ﴿٣٣﴾

---

**zalandırarıq.** (كَذٰلِكَ نَجْزِي الظَّالِمِينَ) – **zalımlara da** (cəhənnəmdə) **belə** (əzab verib) **cəzalandırarıq.**

**30)** (اَوَلَمْ يَرَ الَّذِينَ كَفَرُوا اَنَّ السَّمٰوَاتِ وَالْاَرْضَ كَانَتَا رَتْقًا فَفَتَقْنَاهُمَا) - **o kafirlər baxıb görmürlər ki, həqiqətən, səmalar və yer bağlı olduğu,** (yağış yağmayıb, ot bitmədiyi) **halda biz onları açıb** (yağış yağdırıb, bitki yetişdirmişik?) (وَجَعَلْنَا مِنَ الْمَاءِ كُلَّ شَيْءٍ حَيٍّ اَفَلَا يُؤْمِنُونَ) – **canlı** (cansız) **hər şeyi sudan yaratdıq,** (o səbəbdən səmadan yağış göndərdik ki, həyat bərqərar olsun)**, yenə iman gətirməyib,** (tövhidimizi təsdiq etmirlər)**?**

**31)** (وَجَعَلْنَا فِي الْاَرْضِ رَوَاسِيَ اَنْ تَمِيدَ بِهِمْ) - (yerin əksəriyyəti su içində olduğundan insanlar iztirab içində) **silkələnməsin deyə yer üzündə möhkəm uca dağlar* yaratdıq,** (وَجَعَلْنَا فِيهَا فِجَاجًا سُبُلًا لَعَلَّهُمْ يَهْتَدُونَ) - **və** (yer üzündə olan dağların arasında) **geniş yollar saldıq ki,** (bu sayədə) **asanlıqla yol tapıb** (məqsədlərinə çatsınlar. Məkkəyə gedənlər Məkkə ilə Mədinə arasında o dağları və o yolları yaxşı bilirlər. Hərçənd mən həqir Məkkəni ziyarət etməklə hələ şərəflənməmişəm, amma coğrafiya elminin sayəsində o haqda bir qədər məlumatım var. Bəli, insanı ucaldan elmdir)**.**

*(*Qeyd: Coğrafiyaşünasların tədqiqatından belə məlum olur ki, yer əvvəllər düz olub, zaman içində zəlzələdən, ya da yerin bətnində olan mədənlərin buxarlanması ilə yerdə dəliklər açılıb oralardan uca dağlar çıxıbdır. Necə ki hər bir zamanda yanardağlar müşahidə olunur, lakin zikr olunan ayə bu iddianı rədd edir, yəni Allah-Təala öz hikmətilə yerdə əvvəlcə uca dağlar yaradıbdır).*

**32)** (وَجَعَلْنَا السَّمَاءَ سَقْفًا مَحْفُوظًا) – (ey Məhəmməd, insanlardan ötrü) **səmanı qorunmuş tavan edib,** (onda bizim tövhidimizə işarə edən açıq-aşkar dəlil və sübutlar qoyduq. Belə ki, xalq onlardan ibrət alıb müvəhhid olsun)**.** (وَهُمْ عَنْ اٰيَاتِهَا مُعْرِضُونَ) – (halbuki müşriklər və kafirlər) **bu dəlil və sübutlardan üz döndərib** (ibrət almırlar)**.**

**33)** (وَهُوَ الَّذِي خَلَقَ الَّيْلَ وَالنَّهَارَ وَالشَّمْسَ وَالْقَمَرَ) – (sizə fayda versin deyə) **gecəni və gündüzü, günəşi və ayı yaradan Allah-Təaladır.** (كُلٌّ فِي فَلَكٍ يَسْبَحُونَ) – (ulduzların hamısı kürə şəklində olduğundan dairə şəklində hərəkət edərlər, buna fələk deyilir. Ayənin mənası belədir: günəş, ay və digər ulduzların) **hər biri** (öz orbitində) **hərəkət edib** (oradan kənara çıxmazlar. Bu məna yeni astronomiyanın isbatına böyük dəlildir. Təfsirçilərdən bəziləri deyib ki, fələklərdən

**وَمَا جَعَلْنَا لِبَشَرٍ مِنْ قَبْلِكَ الْخُلْدَ اَفَاۨئِنْ مِتَّ فَهُمُ الْخَالِدُونَ ﴿٣٤﴾ كُلُّ نَفْسٍ ذَٓائِقَةُ الْمَوْتِ وَنَبْلُوكُمْ**
**بِالشَّرِّ وَالْخَيْرِ فِتْنَةً وَاِلَيْنَا تُرْجَعُونَ ﴿٣٥﴾ وَاِذَا رَاٰكَ الَّذِينَ كَفَرُوا اِنْ يَتَّخِذُونَكَ اِلَّا هُزُوًا اَهٰذَا الَّذِي**
**يَذْكُرُ اٰلِهَتَكُمْ وَهُمْ بِذِكْرِ الرَّحْمٰنِ هُمْ كَافِرُونَ ﴿٣٦﴾ خُلِقَ الْاِنْسَانُ مِنْ عَجَلٍ سَاُرِيكُمْ اٰيَاتِي فَلَا**
**تَسْتَعْجِلُونِ ﴿٣٧﴾ وَيَقُولُونَ مَتٰى هٰذَا الْوَعْدُ اِنْ كُنْتُمْ صَادِقِينَ ﴿٣٨﴾ لَوْ يَعْلَمُ الَّذِينَ كَفَرُوا حِينَ**
**لَا يَكُفُّونَ عَنْ وُجُوهِهِمُ النَّارَ وَلَا عَنْ ظُهُورِهِمْ وَلَا هُمْ يُنْصَرُونَ ﴿٣٩﴾**

---

məqsəd səmadır. Bəzisi deyib ki, fələkdən məqsəd dənizdir, günəş, ay və digər ulduzlar onun içində hərəkət edir. Başqa mənasız sözlər də deyiblər)**.**

**34)** (وَمَا جَعَلْنَا لِبَشَرٍ مِنْ قَبْلِكَ الْخُلْدَ) **-** (müşriklər deyirdilər ki, gözləyək görək Məhəmməd nə vaxt ölür, biz də o vaxt şadlıq edib onun ölməyini bayram edərik. Bu ayə buna görə nazil oldu, buyurur: ey Məhəmməd)**, səndən əvvəl insanlardan heç kimi** (dünyada) **əbədi etməmişik,** (hamısı ölüb gedibdir)**.** (اَفَاۨئِنْ مِتَّ فَهُمُ الْخَالِدُونَ) **– sən ölsən, onlar əbədi qalacaqlar?** (Nəyi bayram edirlər? Sənin kimi onlar da ölüb gedəcəklər. Heç kim əbədi qalmayacaq)**.**

**35)** (كُلُّ نَفْسٍ ذَٓائِقَةُ الْمَوْتِ) **- hər kəs** (hər canlı) **ölümü dadacaqdır.** (وَنَبْلُوكُمْ بِالشَّرِّ وَالْخَيْرِ فِتْنَةً) **–** (dünyada) **sizi xeyir və şərlə** (bəla və müsibətə səbir etməklə, nemətə isə şükür etməklə) **imtahan edərik.** (وَاِلَيْنَا تُرْجَعُونَ) **– axırda bizə dönüb,** (əməlinizə görə qarşılıq alacaqsınız)**.**

**36)** (وَاِذَا رَاٰكَ الَّذِينَ كَفَرُوا اِنْ يَتَّخِذُونَكَ اِلَّا هُزُوًا) **-** (ey Məhəmməd)**, kafir olanlar səni gördükdə, istehza edib** (nalayiq sözlər) **deyirlər,** (اَهٰذَا الَّذِي يَذْكُرُ اٰلِهَتَكُمْ) **–** (istehza ilə deyirlər ki,) **sizin ilahlarınızı qınayan** (Məhəmməd) **budur?** (Bu kimdir ki, sizin məbudlarınıza eyib tutur?) (وَهُمْ بِذِكْرِ الرَّحْمٰنِ هُمْ كَافِرُونَ) **–** (ey Məhəmməd, halbuki sən Allah-Təalanı Rəhman adıyla zikr etsən də) **onlar** (Allahın) **Rəhman adını inkar edirlər.** (Rəhman nədir, bilmirik, deyirlər. Onlar özləri istehzaya layiqdirlər)**.**

**37)** (خُلِقَ الْاِنْسَانُ مِنْ عَجَلٍ) **-** (Hz. peyğəmbər müşriklərə əzab vəd etdiyindən onlar istehza ilə deyirdilər: "Tələsirik, görək sənin əzabın nə vaxt gələcək?" Allah-Təala zikr olunan ayəni buna görə göndərdi, buyurur:) **insan tələsən yaradılıbdır,** (təbiətində tələsmək xüsusiyyəti var)**.** (سَاُرِيكُمْ اٰيَاتِي فَلَا تَسْتَعْجِلُونِ) **–** (əzab istəməkdə) **tələsməyin, əlbəttə, mən sizə öz ayələrimi göstərib** (vaxtı gələndə sizə əzab göndərəcəyəm)**.**

**38)** (وَيَقُولُونَ مَتٰى هٰذَا الْوَعْدُ اِنْ كُنْتُمْ صَادِقِينَ) **–** (müşriklər peyğəmbərə və möminlərə) **dedilər: əgər doğru deyirsinizsə, bu əzabın vədi nə vaxtdır?** (O vaxtı bizə bəyan edin. Qoy o əzab tez gəlsin)**.**

**39)** (لَوْ يَعْلَمُ الَّذِينَ كَفَرُوا حِينَ لَا يَكُفُّونَ عَنْ وُجُوهِهِمُ النَّارَ وَلَا عَنْ ظُهُورِهِمْ وَلَا هُمْ يُنْصَرُونَ) **-** (ey Məhəmməd)**, kafir olan şəxslər** (müşriklər) **o vaxt cəhənnəm odunu**

بَلْ تَأْتِيهِمْ بَغْتَةً فَتَبْهَتُهُمْ فَلَا يَسْتَطِيعُونَ رَدَّهَا وَلَا هُمْ يُنْظَرُونَ ﴿٤٠﴾ وَلَقَدِ اسْتُهْزِئَ بِرُسُلٍ مِنْ
قَبْلِكَ فَحَاقَ بِالَّذِينَ سَخِرُوا مِنْهُمْ مَا كَانُوا بِهِ يَسْتَهْزِؤُنَ ﴿٤١﴾ قُلْ مَنْ يَكْلَؤُكُمْ بِالَّيْلِ وَالنَّهَارِ مِنَ
الرَّحْمٰنِ بَلْ هُمْ عَنْ ذِكْرِ رَبِّهِمْ مُعْرِضُونَ ﴿٤٢﴾ اَمْ لَهُمْ اٰلِهَةٌ تَمْنَعُهُمْ مِنْ دُونِنَاۜ لَا يَسْتَطِيعُونَ نَصْرَ
اَنْفُسِهِمْ وَلَا هُمْ مِنَّا يُصْحَبُونَ ﴿٤٣﴾ بَلْ مَتَّعْنَا هٰٓؤُلَٓاءِ وَاٰبَٓاءَهُمْ حَتّٰى طَالَ عَلَيْهِمُ الْعُمُرُۜ

---

**üzlərindən və arxalarından dəf edə bilməyəcəklərini və onlara** (əzabdan xilas olmaq üçün) **heç bir kömək də olmayacağını bilsələrdi,** (sənə istehza etməyib və əzab istəməkdə tələsməyib imana daxil olardılar. Axirət əzabına inanmadıqlarından sənə istehza edib küfr və inadlarında qaldılar)**.**

**40)** (بَلْ تَأْتِيهِمْ بَغْتَةً فَتَبْهَتُهُمْ) – (müşriklər zənn edirlər ki, axirət əzabına düçar olmayacaqlar)**. Xeyr,** (cəhənnəm odu) **qəfildən onları yaxalayıb çaşbaş edəcək.** (فَلَا يَسْتَطِيعُونَ رَدَّهَا وَلَا هُمْ يُنْظَرُونَ) – (əzaba düçar olduqlarında) **nə** (cəhənnəm odunu) **dəf etməyə qüdrətləri olmaz, nə də** (günahlarına görə tövbə edib üzrxahlıq etmələri üçün) **onlara möhlət verilməz.**

**41)** (وَلَقَدِ اسْتُهْزِئَ بِرُسُلٍ مِنْ قَبْلِكَ) - (Allah-Təala bu ayədə müşriklər Hz. Peyğəmbərə əziyyət etdiyinə görə, ona təsəlli verir, buyurur: ey Məhəmməd, sənə istehza etdikləri kimi) **səndən əvvəl də peyğəmbərlərə də istehza ediblər,** (müşriklərin istehza etməsinə səbir edib dilxor olma)**.** (فَحَاقَ بِالَّذِينَ سَخِرُوا مِنْهُمْ مَا كَانُوا بِهِ يَسْتَهْزِؤُنَ) – (əvvəlki peyğəmbərlərə) **istehza edənləri istehza etdikləri şey** (əzab) **əhatə edib** (cəzalandırıldılar, habelə bu müşriklərə də istehzalarının cəzası veriləcək)**.**

**42)** (قُلْ مَنْ يَكْلَؤُكُمْ بِالَّيْلِ وَالنَّهَارِ مِنَ الرَّحْمٰنِ) - (ey Məhəmməd, müşriklərə) **de ki, sizi gecə, ya da gündüz** (Allah-Təalanın əzabından) **kim qoruyub saxlaya bilər?** (Allah-Təaladan başqası qoruya bilməz)**.** (بَلْ هُمْ عَنْ ذِكْرِ رَبِّهِمْ مُعْرِضُونَ) - (ey Məhəmməd)**, ancaq** (müşriklər) **öz rəbləri Allah-Təalanın öyüd-nəsihətindən üz döndərib** (Onun əzabından qorxmurlar)**.**

**43)** (اَمْ لَهُمْ اٰلِهَةٌ تَمْنَعُهُمْ مِنْ دُونِنَا) - (ey Məhəmməd, bəlkə bu müşriklər bizim əzabımızdan ona görə qorxmurlar ki, onları cəhənnəm odundan, əzabdan) **qoruyub xilas edəcək bizdən başqa ilahları var?** (لَا يَسْتَطِيعُونَ نَصْرَ اَنْفُسِهِمْ وَلَا هُمْ مِنَّا يُصْحَبُونَ) – (o bütlər) **heç özlərinə kömək etməyə qadir deyil, bizim tərəfimizdən də yardım olunub** (əzabdan qoruna bilməzlər, müşriklərə necə kömək edə biləcəklər? Bu müşriklər niyə məğrur olub bizim itaətimizdən çıxırlar?)

**44)** (بَلْ مَتَّعْنَا هٰٓؤُلَٓاءِ وَاٰبَٓاءَهُمْ حَتّٰى طَالَ عَلَيْهِمُ الْعُمُرُ) – **həqiqətən, biz** (bu müşriklərə) **və ata-babalarına uzun ömürləri boyu** (dünya) **neməti verdik.** (Bu səbəbdən əzabımızdan qafil və xatircəm olub qorxmadılar və asi olub nankorluq

اَفَلَا يَرَوْنَ اَنَّا نَأْتِي الْاَرْضَ نَنْقُصُهَا مِنْ اَطْرَافِهَاۜ اَفَهُمُ الْغَالِبُونَ ﴿٤٤﴾ قُلْ اِنَّمَٓا اُنْذِرُكُمْ بِالْوَحْيِۘ وَلَا
يَسْمَعُ الصُّمُّ الدُّعَٓاءَ اِذَا مَا يُنْذَرُونَ ﴿٤٥﴾ وَلَئِنْ مَسَّتْهُمْ نَفْحَةٌ مِنْ عَذَابِ رَبِّكَ لَيَقُولُنَّ يَا وَيْلَنَٓا اِنَّا
كُنَّا ظَالِمِينَ ﴿٤٦﴾ وَنَضَعُ الْمَوَازِينَ الْقِسْطَ لِيَوْمِ الْقِيٰمَةِ فَلَا تُظْلَمُ نَفْسٌ شَيْـًٔاۜ وَاِنْ كَانَ مِثْقَالَ حَبَّةٍ
مِنْ خَرْدَلٍ اَتَيْنَا بِهَاۜ وَكَفٰى بِنَا حَاسِبِينَ ﴿٤٧﴾ وَلَقَدْ اٰتَيْنَا مُوسٰى وَهٰرُونَ الْفُرْقَانَ وَضِيَٓاءً وَذِكْرًا
لِلْمُتَّقِينَۙ ﴿٤٨﴾

---

etdilər). (اَفَلَا يَرَوْنَ اَنَّا نَأْتِي الْاَرْضَ نَنْقُصُهَا مِنْ اَطْرَافِهَا) – **bəs** (müşriklər) **baxıb görmürlər ki, həqiqətən, biz** (möminlərə kömək edib müşriklərin) **torpaqlarını hər tərəfdən** (fəth edib) **azaldıb,** (müsəlmanları onlara hakim edib onlara əzab göndərdik? Əvvəlki ümmətlərə də belə etdiyimizi görmürlər?) (اَفَهُمُ الْغَالِبُونَ) – (ey Məhəmməd, bəlkə, bu müşriklər zənn edir ki,) **sənə qalib gələcəklər,** (əlbəttə, belə olmayacaq, əvvəlki kafir və müşriklər məğlub olduğu kimi bu müşriklər də məğlub olacaqlar. Allah-Təalanın vədi doğru olub Məkkə əhli və digər müşriklərin hamısı müsəlmanların əlində məğlub oldular)**.**

**45)** (قُلْ اِنَّمَا اُنْذِرُكُمْ بِالْوَحْيِ) – (ey Məhəmməd, müşriklərə) **de ki, həqiqətən, mən sizi vəhy** (olan Quranla, Allahın əzabı ilə) **qorxuduram.** (وَلَا يَسْمَعُ الصُّمُّ الدُّعَٓاءَ اِذَا مَا يُنْذَرُونَ) – (lakin ey Məhəmməd, haqq sözləri eşitməkdən) **kar olan** (müşriklər Allah-Təalanın əzabı ilə) **qorxudulduqları zaman bu dəvəti eşidib qulaq asmazlar.**

**46)** (وَلَئِنْ مَسَّتْهُمْ نَفْحَةٌ مِنْ عَذَابِ رَبِّكَ) - (ey Məhəmməd)**, əgər rəbbin Allah-Təalanın əzabından** (bu müşriklərə) **bir şey dəyib toxunsa,** (zəlil olub zülm etdiklərini təsdiq edərlər). (لَيَقُولُنَّ يَا وَيْلَنَٓا اِنَّا كُنَّا ظَالِمِينَ) – (onlara əzab nazil olanda belə) **deyərlər: vay halımıza, həqiqətən, biz (**Allah-Təalaya şərik qoşmaqla) **zalım olmuşuq.**

**47)** (وَنَضَعُ الْمَوَازِينَ الْقِسْطَ لِيَوْمِ الْقِيٰمَةِ فَلَا تُظْلَمُ نَفْسٌ شَيْـًٔا) – **biz qiyamət günündə** (qiyamət əhlindən ötrü) **ədalət tərəzilərini qoyarıq.** (Hər kəsin əməlini çəkib, öz qarşılığını verərik)**, heç kimə zülm edilməz.** (وَاِنْ كَانَ مِثْقَالَ حَبَّةٍ مِنْ خَرْدَلٍ اَتَيْنَا بِهَا وَكَفٰى بِنَا حَاسِبِينَ) – **bir xardal dənəsi ağırlığında** (xeyir, ya da şər əməli) **olsa da, biz onu** (haqq-hesab üçün) **gətirərik, haqq-hesab çəkmək üçün təkcə biz kifayət edərik.** (Qiyamət günü bizdən başqa haqq-hesab çəkən olmaz)**.**

**48)** (وَلَقَدْ اٰتَيْنَا مُوسٰى وَهٰرُونَ الْفُرْقَانَ وَضِيَٓاءً وَذِكْرًا لِلْمُتَّقِينَ) – (ey Məhəmməd)**, həqiqətən, biz Musa ilə Haruna** (haqla batil arasına) **fərq qoyan** (Tövratı) **verdik** və (Tövratın səbəbinə) **onlara bir nur və müttəqilər üçün öyüd-nəsihət bəxş etdik** (ki, onun nuru ilə aydınlanıb, onun nəsihətləri ilə nicat tapsınlar)**.**

اَلَّذِينَ يَخْشَوْنَ رَبَّهُمْ بِالْغَيْبِ وَهُمْ مِنَ السَّاعَةِ مُشْفِقُونَ ﴿٤٩﴾ وَهٰذَا ذِكْرٌ مُبَارَكٌ اَنْزَلْنَاهُ اَفَاَنْتُمْ لَهُ
مُنْكِرُونَ ﴿٥٠﴾ وَلَقَدْ اٰتَيْنَا اِبْرٰهِيمَ رُشْدَهُ مِنْ قَبْلُ وَكُنَّا بِهِ عَالِمِينَ ﴿٥١﴾ اِذْ قَالَ لِاَبِيهِ وَقَوْمِهِ مَا
هٰذِهِ التَّمَاثِيلُ الَّتِي اَنْتُمْ لَهَا عَاكِفُونَ ﴿٥٢﴾ قَالُوا وَجَدْنَا اٰبَاءَنَا لَهَا عَابِدِينَ ﴿٥٣﴾ قَالَ لَقَدْ كُنْتُمْ
اَنْتُمْ وَاٰبَاؤُكُمْ فِي ضَلَالٍ مُبِينٍ ﴿٥٤﴾ قَالُوا اَجِئْتَنَا بِالْحَقِّ اَمْ اَنْتَ مِنَ اللَّاعِبِينَ ﴿٥٥﴾

---

**49)** (اَلَّذِينَ يَخْشَوْنَ رَبَّهُمْ بِالْغَيْبِ وَهُمْ مِنَ السَّاعَةِ مُشْفِقُونَ) – (müttəqilər) **o şəxslərdir ki, öz rəbləri Allah-Təaladan qaibanə şəkildə qorxub və qiyamət** (günündən) **çəkinib** (əzabdan xatircəm olmazlar)**.**

**50)** (وَهٰذَا ذِكْرٌ مُبَارَكٌ اَنْزَلْنَاهُ) **- bu** (Quran bərəkəti və xeyri çox olan)**, nazil etdiyimiz mübarək bir nəsihətdir,** (ondan əvvəl də Tövratı nazil etmişdik)**.** (اَفَاَنْتُمْ لَهُ مُنْكِرُونَ) – (ey müşriklər, siz bu xeyirli Quranı) **inkar edirsiniz?**

**51)** (وَلَقَدْ اٰتَيْنَا اِبْرٰهِيمَ رُشْدَهُ مِنْ قَبْلُ) **-** (ey Məhəmməd)**, həqiqətən, biz** (Musa və Harundan) **qabaq İbrahimə hidayət yolunu bəxş etdik.** (وَكُنَّا بِهِ عَالِمِينَ) **- biz** (İbrahimdə olan gözəl xüsusiyyətlərə) **agah idik,** (o səbəbdən onu seçib özümüzə dost etdik)**.**

**52)** (اِذْ قَالَ لِاَبِيهِ وَقَوْمِهِ مَا هٰذِهِ التَّمَاثِيلُ الَّتِي اَنْتُمْ لَهَا عَاكِفُونَ) **-** (ey Məhəmməd, yadına sal ki, o zaman İbrahim bütpərəst atasına və qövmünə belə demişdi:) **davamlı ibadət etdiyiniz bu surətlər** (bütlər) **nədir?** (Hz. İbrahim bütləri müşriklərin nəzərinə həqir göstərməkdən ötrü belə dedi. Hz. İbrahim 16 yaşında peyğəmbər olub xalqı Allah-Təalaya dəvət etməyə başladı, heç bir köməyi də yox idi, hətta atası da ona düşmən idi. Bu ayədəki Hz. İbrahimin yad olunan ilk dəvətidir)**.**

**53)** (قَالُوا وَجَدْنَا اٰبَاءَنَا لَهَا عَابِدِينَ) – (Hz. İbrahimin cavabında) **dedilər: "Ata-babalarımızı** (bu bütlərə) **ibadət edən gördük,** (biz də onlara tabe olub təqlid edib bu bütlərə sitayiş edirik)**."**

**54)** (قَالَ لَقَدْ كُنْتُمْ اَنْتُمْ وَاٰبَاؤُكُمْ فِي ضَلَالٍ مُبِينٍ) – (Hz. İbrahim) **dedi: "Ata-babalarınız, siz də** (onları təqlid edib bu bütlərə sitayiş etməklə) **açıq-aşkar zəlalətdəsiniz."** (Din və məzhəbdə təqlidçilik necə də pis şeydir, təqlid insanı Allah-Təalanın ona əmanət verdiyi ağıldan məhrum edib, haqqı batildən ayırd etməsinə əngəldir. Doğru yolu, ağıl yolunu tərk edib, ata-babanı təqlid edərək bütpərəst olmaq səfehliyin ən yüksək dərəcəsidir, özləri səfehliyin ən yüksək mərtəbəsində ola-ola Allah-Təalanın elçilərini səfeh, hətta divanə adlandırıblar. Dəlil və sübut olmadan təqlidlə alınan şeylər etibarsız şeylərdir)**.**

**55)** (قَالُوا اَجِئْتَنَا بِالْحَقِّ اَمْ اَنْتَ مِنَ اللَّاعِبِينَ) – (müşriklər özlərini haqq yolda bildiklərindən Hz. İbrahimin onları zəlalətdə saymasından təəccüblənib Hz. İbrahimin

قَالَ بَلْ رَبُّكُمْ رَبُّ السَّمٰوَاتِ وَالْاَرْضِ الَّذٖي فَطَرَهُنَّ وَاَنَا عَلٰى ذٰلِكُمْ مِنَ الشَّاهِدٖينَ ﴿٥٦﴾ وَتَاللّٰهِ لَاَكٖيدَنَّ اَصْنَامَكُمْ بَعْدَ اَنْ تُوَلُّوا مُدْبِرٖينَ ﴿٥٧﴾

---

onlarla zarafat etdiyini xəyal etdilər. Hz. İbrahimə belə) **dedilər: "**(ey İbrahim)**, sən bizə haqla gəldin,** (haqlısan)**, yoxsa oyunbazsan,** (zarafat edirsən?)

**56)** (قَالَ بَلْ رَبُّكُمْ رَبُّ السَّمٰوَاتِ وَالْاَرْضِ الَّذٖي فَطَرَهُنَّ) – (Hz. İbrahim dedi: Əlbəttə, düz deyirəm, zarafat etmirəm, ibadət etdiyiniz o bütlər batildir)**, sizin rəbbiniz səmaların və yerin rəbbi Allah-Təaladır ki, onları** (yoxdan) **yaradıbdır.** (وَاَنَا عَلٰى ذٰلِكُمْ مِنَ الشَّاهِدٖينَ) – **mən də buna şahid olanlardanam.** (Hər bir dəvətçi dəlil-sübutla gəldiyi kimi mən də dəlil-sübutla gəlib rəbbinizin Allah-Təala olduğunu isbat etməyə qadirəm. Sizin kimi isbat etməkdən aciz deyiləm, hansı ki, bütpərəst olmaqda ata-babalarınızı təqlid etməkdən başqa dəliliniz yoxdur*)**.**

*(***Qeyd:** Bizim bu dövrümüzdəki müsəlmanların da vəziyyəti belədir. Şəriətin əleyhinə olan adətlər onların arasında rəvac tapıb, Qurani-Şərifin ehkamı təhrif olunubdur. Əgər onlardan soruşsan ki, Qurana və islama zidd bu nə əməllərdir edirsiniz? Belə deyərlər: "Biz ata-babadan belə görmüşük, bundan vaz keçən deyilik." Üləmaya Quran haqqında sual verəndə isə deyirlər: "Siz, gərək, bizim dediyimizi edəsiniz, Quranın mənasını imamlardan başqası bilməz." Kim bildiyini iddia etsə, onun sözü batildir. Ey müsəlmanlar, insafla fikir verib baxın, təqlidi kənara qoyub vicdanınızla hərəkət edin. Heç elə şey olar ki, möhtərəm peyğəmbərimiz Hz. Məhəmməd Allah-Təaladan kitab gətirib onu əbədi qanun, hər hökmü bəyan edən kitab elan etsin, amma belə bir kitabı kənara qoyub, onu tapmaca və müəmma sayıb günəş kimi parlaq olan hökmlərini gizlətsinlər. Ondan sonra islam adı ilə özlərindən təzə qanun yaradıb, xalqa ona bağlanıb, Quranı tərk etmələrini əmr etsinlər. Halbuki islamın digər dinlərə olan üstünlüyü elə Qurani-Şərifə görədir. Qurani-Şərifi bir kənara qoyanda islamın haqq din olmasına nə dəlil-sübut qalır? Yəhudilərin üləmalarına lənət edirik ki, Tövratı təhrif edib, ehkamını dəyişdirib, öz istəklərinə uyğun hökmlər yaradıblar. Əgər insafla baxsaq, bugünkü gündə Qurani-Şərifin halı Tövratın halı kimidir. Bundan artıq nə təhrif olar ki, həqiqi islam alimlərinə görə onunla əməl edilməsi caiz olmayan vahid xəbəri (zəif hədisi) Qurani-Şərifə bərabər sayıb, ya da Quranı onunla məhdud edib, ya da Quranı birdəfəlik tərk edib vahid xəbərlə əməl etməyi vacib sayırlar. Buna bircə misal verib qalanını ağıl sahiblərinin düşüncəsinə həvalə edirik. Qurani-Şərifdə Nur surəsində Allah-Təala zinakar arvadla mömin kişinin və isмətli mömin qadınla da zinakar kişinin evlənməsini açıq-aşkar haram edib. Amma fəqihlər bu ayəni kənara qoyub, vahid xəbəri dəlil sayıb, bu evliliyin haram yox, məkruh olduğuna dair fitva veriblər. Allah-Təalanın kitabına bundan da artıq xilaf çıxmaq olarmı?)*

**57)** (وَتَاللّٰهِ لَاَكٖيدَنَّ اَصْنَامَكُمْ بَعْدَ اَنْ تُوَلُّوا مُدْبِرٖينَ) – (Hz. İbrahim müşriklərin imana daxil olmasından ümidini kəsdikdə dedi:) **and olsun, Allah-Təalaya ki,** (bayram günü şəhərdən) **çıxıb getdiyinizdə bütlərinizə hiylə edəcəyəm.** (Hz. İbrahim bu sözü gizlində dedi, bayram günü gələndə hamısı bütxanaya gedib

فَجَعَلَهُمْ جُذَاذًا اِلَّا كَبِيرًا لَهُمْ لَعَلَّهُمْ اِلَيْهِ يَرْجِعُونَ ﴿٥٨﴾ قَالُوا مَنْ فَعَلَ هٰذَا بِاٰلِهَتِنَٓا اِنَّهُ لَمِنَ
الظَّالِمِينَ ﴿٥٩﴾ قَالُوا سَمِعْنَا فَتًى يَذْكُرُهُمْ يُقَالُ لَهُٓ اِبْرٰهِيمُ ﴿٦٠﴾ قَالُوا فَأْتُوا بِهِ عَلٰٓى اَعْيُنِ النَّاسِ
لَعَلَّهُمْ يَشْهَدُونَ ﴿٦١﴾ قَالُٓوا ءَاَنْتَ فَعَلْتَ هٰذَا بِاٰلِهَتِنَا يَٓا اِبْرٰهِيمُ ﴿٦٢﴾ قَالَ بَلْ فَعَلَهُ كَبِيرُهُمْ هٰذَا
فَسْـَٔلُوهُمْ اِنْ كَانُوا يَنْطِقُونَ ﴿٦٣﴾

---

bütlərin qabağında səcdə etdilər, ondan sonra adətləri üzrə şəhərdən kənara çıxdılar. Hz. İbrahimin atası İbrahimə də onlarla birlikdə getməyi təklif etdi. Hz. İbrahim qəbul etməyib şəhərdə qaldı)**.**

**58)** (فَجَعَلَهُمْ جُذَاذًا اِلَّا كَبِيرًا لَهُمْ لَعَلَّهُمْ اِلَيْهِ يَرْجِعُونَ) – (camaat şəhərdən çıxdıqda, Hz. İbrahim gedib möhkəm daş* bir balta götürüb, bütxananın nəzarətçisinin diqqətsizliyindən istifadə edib ora girdi. Bütlərə baxdı, bütxanada 70 büt var idi. Hamısı ayaq üstündə düzülmüş, bəzisi ağacdan, bəzisi daşdan idi. Bir böyük büt də var idi ki, gözlərinin yerində qızıldan iki gövhər şimşək kimi parıldayırdı. (Hz. İbrahim o daş balta ilə o bütlərin hamısını parça-parça edib, ancaq o böyük bütə dəyməyib, baltanı da onun çiyninə qoydu ki, camaat o bütə inandıqlarından çöldən qayıdandan sonra gəlib nə olduğunu ondan soruşsunlar)**.**

*(***Qeyd:** Hz. İbrahimin yaşadığı dövr daş dövrü idi. O dövrdə hər bir alət daşdan hazırlanırdı. Sonra bürünc dövrü gəlib, hər bir aləti bürüncdən hazırlamağa başladılar. Ondan sonra İran sultanı Cəmşidin zamanında dəmir dövrü başladı. O zamandan indiyə kimi hər bir aləti dəmirdən düzəltmək adəti yayıldı. Hz. İbrahim 90 yaşında olarkən daş bıçaqla özünü sünnət etmişdi).*

**59)** (قَالُوا مَنْ فَعَلَ هٰذَا بِاٰلِهَتِنَٓا اِنَّهُ لَمِنَ الظَّالِمِينَ) – (camaat çöldən qayıdıb bütləri o halda görəndə, çaşbaş qalıb bir-birilərinə) **dedilər: "Bizim ilahlarımıza bu əməli kim edibsə, o, həqiqətən zalımlardandır** (ki, belə işə cürət edib bizim bu möhtərəm ilahlarımızı bu günə qoyub)**.**

**60)** (قَالُوا سَمِعْنَا فَتًى يَذْكُرُهُمْ يُقَالُ لَهُٓ اِبْرٰهِيمُ) – (müşriklərdən bəziləri cavab verib) **dedilər: "İbrahim deyilən bir gəncin** (ilahlarımızı) **pislədiyini eşitmişik.** (Ola bilər ki, o edib)**."**

**61)** (قَالُوا فَأْتُوا بِهِ عَلٰٓى اَعْيُنِ النَّاسِ لَعَلَّهُمْ يَشْهَدُونَ) – (müşriklərin böyükləri) **dedilər: "Onu insanların gözünün qabağına gətirin ki, bəlkə, onu tanıyıb şəhadət etsinlər** (ki, həqiqətən, bunu o edib, biz də ona əzab edək)**."**

**62)** (قَالُٓوا ءَاَنْتَ فَعَلْتَ هٰذَا بِاٰلِهَتِنَا يَٓا اِبْرٰهِيمُ) – (Hz. İbrahimi gətirib) **dedilər: "**(ey İbrahim)**, bizim ilahlarımıza bunu sən edibsən?"**

**63)** (قَالَ بَلْ فَعَلَهُ كَبِيرُهُمْ هٰذَا فَسْـَٔلُوهُمْ اِنْ كَانُوا يَنْطِقُونَ)– (İbrahim) **dedi: "*Bəlkə, bu əməli onların bu böyükləri -** (çiynində balta olan) **edibdir, əgər danışa bilirlərsə, onların özündən soruşun** (bəlkə cavab verərlər)**."**

فَرَجَعُوا اِلٰى اَنْفُسِهِمْ فَقَالُوا اِنَّكُمْ اَنْتُمُ الظَّالِمُونَۙ ﴿٦٤﴾ ثُمَّ نُكِسُوا عَلٰى رُؤُ۫سِهِمْۚ لَقَدْ عَلِمْتَ مَا هٰٓؤُلَٓاءِ يَنْطِقُونَ ﴿٦٥﴾ قَالَ اَفَتَعْبُدُونَ مِنْ دُونِ اللّٰهِ مَا لَا يَنْفَعُكُمْ شَيْـًٔا وَلَا يَضُرُّكُمْۜ ﴿٦٦﴾ اُفٍّ لَكُمْ وَلِمَا تَعْبُدُونَ مِنْ دُونِ اللّٰهِۜ اَفَلَا تَعْقِلُونَ ﴿٦٧﴾

---

*(*Qeyd: Hz. İbrahimin hərçənd onlara yalan cavab verdi, amma kinayə ilə belə dedi ki, onun incə mənasını bəlağət elminə sahib olanlardan başqası dərk edə bilməz. Bəlağət elmində ustad olan Zəməxşərinin bu ayə haqqında xüsusi şərhi var. Ona görə Hz. İbrahimin bu cavabdan məqsədi o deyildi ki, öz etdiyi əməli böyük bütə isnad edib özünü qorusun. Bəlkə, Hz. İbrahimin məqsədi kinayə ilə cavab verib öz məqsədinə çatmaq idi. Hz. İbrahimin məqsədi onları çaşbaş etmək, bütpərəstliklərinə dair bir dəlil tapmayıb, yeganə Allah-Təalaya sitayiş etdirmək idi. Hz. İbrahimə sual veriləndə ki, bunu sən edibsən? Kinayə ilə cavab verdi ki, bəlkə, onların böyükləri edibdir. Necə ki biz türklərin arasında da belə adətdir, əgər bir şəxs yaxşı bir iş görsə, soruşsalar ki, bunu sən edibsən? O da kinayə ilə deyər ki, yox, sən edibsən. Hz. İbrahimin cavabı da belə idi. Bu cavabdan Hz. İbrahimin məqsədi bu idi: onlar bu cavabı eşidəndə anlayacaqlar ki, bu cansız büt belə əməl edə bilməz, o vaxt da qayıdıb İbrahimə deyəcəklər ki, bunu yəqin sən edibsən, bu büt bu işə qadir deyil. O vaxt da Hz. İbrahim dəlil-sübutla onlara deyəcək ki, bir büt ki, belə işə qadir deyil, ağıllı şəxs də ona ibadət edərmi? Necə ki bundan sonrakı ayələrdən onların Hz. İbrahimin qarşısında aciz qaldıqları məlum olur).*

**64)** (فَرَجَعُوا اِلٰى اَنْفُسِهِمْ فَقَالُوا اِنَّكُمْ اَنْتُمُ الظَّالِمُونَ) – elə ki İbrahim onların ağzına bir daş vurub dəlil və sübutla söz dedi), **özlərinə müraciət edib** (fikirləşib) **dedilər: "**(bu kişi düz söz deyir, heç bir şeyə qadir olmayan birinə necə ibadət etmək olar?) **Həqiqətən,** (o, yox)**, siz özünüz zalımsınız."**

**65)** (ثُمَّ نُكِسُوا عَلٰى رُؤُ۫سِهِمْۚ لَقَدْ عَلِمْتَ مَا هٰٓؤُلَٓاءِ يَنْطِقُونَ) – (əvvəlcə haqqı etiraf edib Hz. İbrahimi təsdiq etdilər və özlərinin zalım olduqlarını iqrar etdilər. Ondan) **sonra yenə başlarında olana** (asiliyə) **qayıdıb,** (gözləri ilə Hz. İbrahimi süzüb, başları aşağıda xəcalətlə dedilər: "Ey İbrahim)**, sən ki bilirsən, bu** (bütlər) **danışan deyil,** (niyə bizə istehza edib onlarla danışmağı bizə təklif edirsən?" Hz. İbrahim onların aciz qaldığını görəndə aşağıdakı ayədə göstərildiyi kimi onlara cavab verdi)**.**

**66)** (قَالَ اَفَتَعْبُدُونَ مِنْ دُونِ اللّٰهِ مَا لَا يَنْفَعُكُمْ شَيْـًٔا وَلَا يَضُرُّكُمْ) **-** (Hz. İbrahim) **dedi: "**(indi ki, dininizin batil olduğu sizə məlum oldu, bəs Allah-Təalanı qoyub) **sizə nə mənfəət, nə də zərər verə bilməyən** (o bütlərə yenə) **ibadət edirsiniz?**

**67)** (اُفٍّ لَكُمْ وَلِمَا تَعْبُدُونَ مِنْ دُونِ اللّٰهِ اَفَلَا تَعْقِلُونَ) – **tfu sizə də,** (Allah-Təaladan başqa) **ibadət etdiklərinizə də, heç düşünmürsünüz?"** (Bu nə ağılsız əməldir ki, Allah-Təaladan başqasına ibadət edirsiniz. Hz. İbrahim müşriklərin dəlil-sübut gətirməkdə aciz olsalar da, yenə küfr və inad içində qaldıqlarını görüb onlardan incidiyindən belə dedi)**.**

قَالُوا حَرِّقُوهُ وَانْصُرُوٓا اٰلِهَتَكُمْ اِنْ كُنْتُمْ فَاعِلٖينَ ﴿٦٨﴾ قُلْنَا يَا نَارُ كُونٖي بَرْدًا وَسَلَامًا عَلٰٓى اِبْرٰهٖيمَۙ
﴿٦٩﴾ وَاَرَادُوا بِهٖ كَيْدًا فَجَعَلْنَاهُمُ الْاَخْسَرٖينَۚ ﴿٧٠﴾ وَنَجَّيْنَاهُ وَلُوطًا اِلَى الْاَرْضِ الَّتٖي بَارَكْنَا فٖيهَا
لِلْعَالَمٖينَ ﴿٧١﴾ وَوَهَبْنَا لَهُٓ اِسْحٰقَۜ وَيَعْقُوبَ نَافِلَةًۜ وَكُلًّا جَعَلْنَا صَالِحٖينَ ﴿٧٢﴾

---

**68)** (قَالُوا حَرِّقُوهُ وَانْصُرُوٓا اٰلِهَتَكُمْ اِنْ كُنْتُمْ فَاعِلٖينَ) – (müşriklər Hz. İbrahimin müqabilində dəlil və sübut gətirməkdən aciz qaldıqda, küfr və inadlarından) **dedilər: "**(bu ki sizin ilahlarınıza tənə edir)**, əgər bir iş görənsinizsə, bunu** (odda) **yandırıb ilahlarınıza kömək edin."** (Ondan sonra od yandırıb Hz. İbrahimi tutub atəşin içinə atdılar. Oda atılanda Allah-Təala tərəfindən Ruhül-müqəddəs (Cəbrayıl) Hz. İbrahimə nazil olub dedi: "Ey İbrahim, bir ehtiyacın varmı?" İbrahim dedi: "Ehtiyacım var, amma səndən bir şey istəmirəm", (yəni sən də mənim kimi məxluqsan, səndən nə istəyim? Cəbrayıl dedi: "Ehtiyacını Allah-Təalaya bildir." İbrahim dedi: "Allah-Təalanın məni bilməsi kifayət edər." Buna təvəkkül məqamı deyilir. Təvəkkül məqamında Hz. İbrahim ən üst dərəcədə idi. Oda atılanda Nəmruda tərəf də baxmayıb ondan mərhəmət istəməyib, işini uca yaradıcıya həvalə etdi. Allah-Təala da onun təvəkkülünün müqabilində şəfqət və mərhəmət nəzəriylə ona baxıb onu oddan qorudu, necə ki buyurur)**.**

**69)** (قُلْنَا يَا نَارُ كُونٖي بَرْدًا وَسَلَامًا عَلٰٓى اِبْرٰهٖيمَ) – (ey Məhəmməd, İbrahimi oda atdıqlarında, biz əmr edib oda) **dedik: "Ey od, İbrahimə qarşı sərin və zərərsiz ol."** (Hərarətin ona təsir etməsin. Bu xitab sözlə yox, hal dili ilə oldu. Allah-Təala Hz. İbrahimin bədənini odda yanmaqdan necə qoruyub, odun təsirini ondan götürüb, yoxsa İbrahimin bədənində onu oddan qoruyacaq bir şey yaradıb, bunların həqiqətini ancaq Allah-Təala bilir)**.**

**70)** (وَاَرَادُوا بِهٖ كَيْدًا فَجَعَلْنَاهُمُ الْاَخْسَرٖينَ) – (müşriklər Hz. İbrahimi məğlub etmək üçün) **ona hiylə qurmaq istədilər, amma** (biz ona kömək olub müşrikləri məğlub etdik və) **daha çox zərərə düçar etdik.**

**71)** (وَنَجَّيْنَاهُ وَلُوطًا اِلَى الْاَرْضِ الَّتٖي بَارَكْنَا فٖيهَا لِلْعَالَمٖينَ) – (İbrahimi və onun qardaşı Haran oğlu) **Lutu** (Babildən xilas edib) **bütün aləmlərdən ötrü mübarək** (bərəkətli) **etdiyimiz yerə apardıq.** (Allah-Təala İbrahimi xilas edib Şamda məskun etdirdi və xeyir, bərəkətini ona nazil etdi. Onun dinini yer üzündə yaydı. Elə bir din mənsubu yoxdur ki, onu sevməyib hörmət etməsin)**.**

**72)** (وَوَهَبْنَا لَهُٓ اِسْحٰقَ وَيَعْقُوبَ نَافِلَةً) – (İbrahimə) **İshaqı, həm də** (İshaqdan) **Yaqubu ona** (nəvə) **bəxş etdik.** (وَكُلًّا جَعَلْنَا صَالِحٖينَ) – (İbrahimi, İshaqı, Yaqubu) **hamısını saleh şəxslər etdik.**

وَجَعَلْنَاهُمْ اَئِمَّةً يَهْدُونَ بِاَمْرِنَا وَاَوْحَيْنَآ اِلَيْهِمْ فِعْلَ الْخَيْرَاتِ وَاِقَامَ الصَّلٰوةِ وَاِيتَآءَ الزَّكٰوةِ وَكَانُوا لَنَا عَابِدِينَ ﴿٧٣﴾ وَلُوطًا اٰتَيْنَاهُ حُكْمًا وَعِلْمًا وَنَجَّيْنَاهُ مِنَ الْقَرْيَةِ الَّتِي كَانَتْ تَعْمَلُ الْخَبَٓائِثَ اِنَّهُمْ كَانُوا قَوْمَ سَوْءٍ فَاسِقِينَ ﴿٧٤﴾ وَاَدْخَلْنَاهُ فِي رَحْمَتِنَا اِنَّهُ مِنَ الصَّالِحِينَ ﴿٧٥﴾ وَنُوحًا اِذْ نَادٰى مِنْ قَبْلُ فَاسْتَجَبْنَا لَهُ فَنَجَّيْنَاهُ وَاَهْلَهُ مِنَ الْكَرْبِ الْعَظِيمِ ﴿٧٦﴾ وَنَصَرْنَاهُ مِنَ الْقَوْمِ الَّذِينَ كَذَّبُوا بِاٰيَاتِنَا اِنَّهُمْ كَانُوا قَوْمَ سَوْءٍ فَاَغْرَقْنَاهُمْ اَجْمَعِينَ ﴿٧٧﴾ وَدَاوُدَ وَسُلَيْمٰنَ اِذْ يَحْكُمَانِ فِي الْحَرْثِ اِذْ نَفَشَتْ فِيهِ غَنَمُ الْقَوْمِ وَكُنَّا لِحُكْمِهِمْ شَاهِدِينَ ﴿٧٨﴾

---

**73)** (وَجَعَلْنَاهُمْ اَئِمَّةً يَهْدُونَ بِاَمْرِنَا) **- onların** (hər üçünü yer üzündə) **rəhbərlər etdik ki, əmrimizlə** (xalqa) **hidayət etsinlər.** (وَاَوْحَيْنَآ اِلَيْهِمْ فِعْلَ الْخَيْرَاتِ وَاِقَامَ الصَّلٰوةِ وَاِيتَآءَ الزَّكٰوةِ وَكَانُوا لَنَا عَابِدِينَ) – (şəriət ehkamına əməl edib), **xeyirli iş görməyi, namaz qılıb, zəkat verməyi onlara vəhy etdik. Onlar həmişə bizə ibadət edən şəxslər idilər.**

**74)** (وَلُوطًا اٰتَيْنَاهُ حُكْمًا وَعِلْمًا) **-** (Haran oğlu) **Luta hikmət** (peyğəmbərlik) **və elm bəxş etdik.** (وَنَجَّيْنَاهُ مِنَ الْقَرْيَةِ الَّتِي كَانَتْ تَعْمَلُ الْخَبَائِثَ) **-** (Lutu kişilərə qarşı) **xəbis əməllər edən** (Sodom) **şəhərinin** (əhlindən) **xilas etdik.** (اِنَّهُمْ كَانُوا قَوْمَ سَوْءٍ فَاسِقِينَ) **- həqiqətən,** (Sodom) **qövmü pis və fasiq bir qövm idi.**

**75)** (وَاَدْخَلْنَاهُ فِي رَحْمَتِنَا اِنَّهُ مِنَ الصَّالِحِينَ) **– həqiqətən,** (Lut) **saleh şəxslərdən olduğundan onu rəhmətimizə qovuşdurduq.**

**76)** (وَنُوحًا اِذْ نَادٰى مِنْ قَبْلُ) **- onlardan əvvəl Nuh** (peyğəmbər öz qövmündən bizə şikayət) **və dua etdikdə,** (فَاسْتَجَبْنَا لَهُ فَنَجَّيْنَاهُ وَاَهْلَهُ مِنَ الْكَرْبِ الْعَظِيمِ) – (Nuhun) **duasını qəbul edib** (Nuhun özünü) **və əhlini** (oğullarını və ona iman gətirənləri) **böyük bəladan** (tufandan qərq olmaqdan) **xilas etmişdik.**

**77)** (وَنَصَرْنَاهُ مِنَ الْقَوْمِ الَّذِينَ كَذَّبُوا بِاٰيَاتِنَا) **–bizim ayələrimizi təkzib edən camaata qarşı** (Nuha) **kömək edib,** (o camaatdan intiqam alıb onlara bəla göndərdik)**.** (اِنَّهُمْ كَانُوا قَوْمَ سَوْءٍ فَاَغْرَقْنَاهُمْ اَجْمَعِينَ) **- həqiqətən,** (Nuhun) **qövmü pis** (müşrik) **bir qövm olduğundan** (onlara tufan göndərib) **hamısını qərq etdik.**

**78)** (وَدَاوُدَ وَسُلَيْمٰنَ اِذْ يَحْكُمَانِ فِي الْحَرْثِ اِذْ نَفَشَتْ فِيهِ غَنَمُ الْقَوْمِ) – (bizim 2 peyğəmbərimiz) **Davud və Süleyman da bir tayfanın qoyunlarının gecə vaxtı** (girib) **xarab etdiyi bir əkin sahəsi haqqında hökm verirdilər,** (وَكُنَّا لِحُكْمِهِمْ شَاهِدِينَ) **- biz onların hökmlərinə şahid idik** (ki, o əkin barəsində necə hökm verdilər)**.** (Hz. Davudun hüzuruna bir şəxs gəlib şikayət etdi ki, filan şəxslərin qoyunları gecə vaxtı mənim əkin sahəmə daxil olub yeyib hamısını zay ediblər. Qoyun sahibləri gətiriləndən sonra Hz. Davud hökm etdi ki, o qoyunlar, gərək, əkin sahiblərinə verilsin. 11 yaşlı Süleyman da o məclisdə iştirak edirdi. Atasına dedi ki, hər iki tərəfi düşünərək bu hökmü dəyişdir.

فَفَهَّمْنَاهَا سُلَيْمٰنَۚ وَكُلًّا اٰتَيْنَا حُكْمًا وَعِلْمًاۘ وَسَخَّرْنَا مَعَ دَاوُ۫دَ الْجِبَالَ يُسَبِّحْنَ وَالطَّيْرَۜ وَكُنَّا فَاعِل۪ينَ
﴿٧٩﴾ وَعَلَّمْنَاهُ صَنْعَةَ لَبُوسٍ لَكُمْ لِتُحْصِنَكُمْ مِنْ بَأْسِكُمْۚ فَهَلْ اَنْتُمْ شَاكِرُونَ ﴿٨٠﴾

---

Hz. Davud Hz. Süleymana dedi: “Bu barədə sən hökm ver.” Süleyman dedi: “Mən belə məsləhət görürəm ki, qoyunları əkin sahibinə verəsən ki, onların südündən, yunundan və balalarından mənfəət alsınlar. Əkin yerini də verəsən, qoyun sahiblərinə ki, onu əkib islah etsin, əvvəlki halına gələndən sonra qoyunları öz sahiblərinə, əkini də öz sahibinə qaytar, hər şəxs yenidən öz malına sahib olsun.” Davud Süleymanın bu hökmünü təsdiq edib belə hökm verdi. Allah-Təala sıradakı ayədə Süleymanın hökmünün təsdiqini xəbər verir)**.**

**79)** (فَفَهَّمْنَاهَا سُلَيْمٰنَ) – (ey Məhəmməd, bu əhvalatda necə hökm verməyi) **Süleymana biz anlatdıq.** (وَكُلًّا اٰتَيْنَا حُكْمًا وَعِلْمًا) – (Davud da hökmündə xəta etməmişdi. Bəlkə, hər ikisinin hökmü haqq olub)**, hər birinə hikmət və elm vermişdik,** (lakin Süleymanın hökmü ondan daha yaxşı idi)**.** (وَسَخَّرْنَا مَعَ دَاوُ۫دَ الْجِبَالَ يُسَبِّحْنَ وَالطَّيْرَ) - (Davuda bəxş olunan elm və hikmət bunlardır: ey Məhəmməd)**, quşları və dağları** (Davuda) **tabe edib Davudla birlikdə məni zikr edirdilər.** (وَكُنَّا فَاعِل۪ينَ) – (təəccüblü olsa da, biz buna qadirik)**. Bunları biz etmişik.**

**80)** (وَعَلَّمْنَاهُ صَنْعَةَ لَبُوسٍ لَكُمْ لِتُحْصِنَكُمْ مِنْ بَأْسِكُمْ) - **savaşda sizi** (düşmənin silahından) **qorumaq üçün** (Davuda)* **zireh** (toxuma) **sənətini öyrətdik.** (Allah-Təalanın yardımı ilə zirehi ilk ixtira edən Davud olubdur)**.** (فَهَلْ اَنْتُمْ شَاكِرُونَ) – (bu neməti Davuda sizdən ötrü bəxş etmişəm)**, şükür edəcəksinizmi?** (Yəni hər bir nemətə görə onu verən Allaha şükür etmək vacibdir)**.**

*(*Qeyd:** Loğman həkim Davudun hüzuruna gəldi, gördü əlində dəmirdən bir şey düzəldir. İstədi, sual versin ki, bu nədir? Hikmət sahiblərinin, peyğəmbər və övliyaların bu mübarək sözü onun yadına düşdü, belə buyurublar: “Danışmaq gümüşsə, susmaq qızıldır və sükut edən nicat tapar. Sükut etməkdə böyük faydalar vardır.” Necə ki şeyx Müslihiddin Şirazi belə deyib: “İki şeyi öz zamanına saxlamaq ağlın hissəsindəndir, yeri gələndə danışmaq, yeri gələndə susmaq”, bir də hikmət sahibləri deyiblər ki, şəxs, gərək, danışmaqdan çox qulaq assın. Çünki Allah-Təala insana iki qulaq, bir dil veribdir və əgər çox danışmaq lazım olsaydı, iki dil, bir qulaq verilərdi. Necə ki şair deyir: “İki qulaqla eşit, birdən çox söz danışma“. Uca peyğəmbərimiz buyurubdur: “İnsanın hər eşitdiyini danışması yalançı və günahkar olmasına kifayət edər.” Loğman bu hökmləri düşünüb susdu. Hz. Davud zireh toxumağı bitirib, durub onu əyninə geydi. Dedi: “Nə yaxşı hərb libasıdır.” Loğman bir şey soruşmamış, onun zireh olduğunu anladı. Susmaqla iki fayda əldə etdi. Həm elm əldə etdi, həm də sual vermə zillətindən xilas oldu. Sükutun faydası, xeyri nə qədər yad edilsə, azdır.).*

**وَلِسُلَيْمٰنَ الرّ۪يحَ عَاصِفَةً تَجْر۪ي بِاَمْرِه۪ٓ اِلَى الْاَرْضِ الَّت۪ي بَارَكْنَا ف۪يهَاۜ وَكُنَّا بِكُلِّ شَيْءٍ عَالِم۪ينَ ﴿٨١﴾**
**وَمِنَ الشَّيَاط۪ينِ مَنْ يَغُوصُونَ لَهُ وَيَعْمَلُونَ عَمَلًا دُونَ ذٰلِكَۚ وَكُنَّا لَهُمْ حَافِظ۪ينَۙ ﴿٨٢﴾ وَاَيُّوبَ**
**اِذْ نَادٰى رَبَّهُٓ اَنّ۪ي مَسَّنِيَ الضُّرُّ وَاَنْتَ اَرْحَمُ الرَّاحِم۪ينَۚ ﴿٨٣﴾ فَاسْتَجَبْنَا لَهُ فَكَشَفْنَا مَا بِه۪ مِنْ ضُرٍّ**
**وَاٰتَيْنَاهُ اَهْلَهُ وَمِثْلَهُمْ مَعَهُمْ**

---

**81)** (وَلِسُلَيْمٰنَ الرّ۪يحَ عَاصِفَةً تَجْر۪ي بِاَمْرِه۪ٓ اِلَى الْاَرْضِ الَّت۪ي بَارَكْنَا ف۪يهَا) **- şiddətlə əsən küləyi* də Süleymana tabe etdik. Onun əmriylə** (taxtını da götürüb) **bərəkət** (nemət) **verdiyimiz yerə** (Şama) **doğru əsərdi.** (وَكُنَّا بِكُلِّ شَيْءٍ عَالِم۪ينَ) **– biz hər bir şeyə agahıq,** (heç bir şey bizim elmimizdən kənarda qalmaz)**.**

*(*Qeyd:* *Təfsirçilər küləyin Hz. Süleymanın əmriylə əsməsi haqqında bir çox mənasız sözlər yazıblar. Heç birinə etimad etmək olmaz. Qurani-Şərifdən belə anlaşılır ki, Süleyman havada bir şeyin üstündə küləyin hərəkəti ilə hərəkət edirmiş. Amma o hərəkətin xüsusiyyəti və həqiqəti bizə məlum deyil. Allah-Təalanın insanlara bəxş etdiyi ağılla bu dövrdə yaradılan hava nəqliyyatı vasitələri buna işarə edir ki, Allahın yardımı ilə insanlar hər bir dövrdə belə bir iş görməyə qadir olublar. Allah Hz. Süleymana da belə bir ixtira bəxş etmişdi).*

**82)** (وَمِنَ الشَّيَاط۪ينِ مَنْ يَغُوصُونَ لَهُ) – **asi** (və güclü) **şəxsləri də** (Süleymana) **tabe etdik.** (Belə ki, onun əmriylə) **dalğıclıq edib,** (mirvari və inci çıxartsınlar)**.** (وَيَعْمَلُونَ عَمَلًا دُونَ ذٰلِكَ) – (Süleymandan ötrü) **bundan başqa, əməllər də etsinlər.** (وَكُنَّا لَهُمْ حَافِظ۪ينَ) – (ey Məhəmməd, o asiləri Süleymanın tabeliyində) **saxlayan biz idik.**

**83)** (وَاَيُّوبَ اِذْ نَادٰى رَبَّهُٓ اَنّ۪ي مَسَّنِيَ الضُّرُّ وَاَنْتَ اَرْحَمُ الرَّاحِم۪ينَ) – (peyğəmbərimiz) **Eyyubu da** (yad et)**,** (xəstəlikdən bədənini yara basıb camaat ondan nifrət etdikdə öz rəbbi Allah-Təalaya belə dua etmişdi:) **ey mənim rəbbim, həqiqətən, mənə* ziyan dəyib, sən rəhm edənlərin ən mərhəmətlisisən.**

*(*Qeyd:* *Hz. Eyyub Allah-Təalaya son dərəcə incə şəkildə dua etdi. Allah-Təalanı sonsuz rəhmətlə yad edib özünə zərər dəydiyinə görə, Ondan şəfa istəmədi. Ərəb dilində belə incəliklər çoxdur, amma türk dili onları ifadə etməkdə kafi deyil. Bir qadın Əməvi xəlifələrindən olan Süleyman ibn Əbdülməlikin hüzuruna gedib, dedi: "Ey əmirəl-möminin, mənim evimin siçanları əsaya söykənə-söykənə yol gedirlər." Xəlifə dedi: "Ehtiyacını çox incə və gözəl şəkildə bildirdin, sənin evinin siçanlarını elə edərəm ki, pələng kimi gedərlər." Ondan sonra əmr etdi, onun evini buğda ilə doldurdular. (Arvad aclıqdan rəmz ilə şikayət etdi. Yəni mənim evimdə yeməli heç nə yoxdur, o səbəbdən evimdəki siçanlar da aclıqdan, sanki, əsaya söykənə-söykənə yol gedirlər. Süleyman ibn Əbdülməlik də onun bu incə ifadəsindən nə demək istədiyini anlayıb müvafiq cavab verərək ehtiyacını həll etdi).*

**84)** (فَاسْتَجَبْنَا لَهُ فَكَشَفْنَا مَا بِه۪ مِنْ ضُرٍّ) – (Eyyubun) **duasını qəbul edib** (xəstəliyinə şəfa verib) **dərddən qurtardıq.** (وَاٰتَيْنَاهُ اَهْلَهُ وَمِثْلَهُمْ مَعَهُمْ) – (Eyyub özü bə-

رَحْمَةً مِنْ عِنْدِنَا وَذِكْرٰى لِلْعَابِدِينَ ﴿٨٤﴾ وَاِسْمٰعِيلَ وَاِدْرِيسَ وَذَا الْكِفْلِ كُلٌّ مِنَ الصَّابِرِينَ ۚ
﴿٨٥﴾ وَاَدْخَلْنَاهُمْ فِي رَحْمَتِنَا اِنَّهُمْ مِنَ الصَّالِحِينَ ﴿٨٦﴾ وَذَا النُّونِ اِذْ ذَهَبَ مُغَاضِبًا فَظَنَّ اَنْ
لَنْ نَقْدِرَ عَلَيْهِ فَنَادٰى فِي الظُّلُمَاتِ اَنْ لَٓا اِلٰهَ اِلَّٓا اَنْتَ سُبْحَانَكَ اِنِّي كُنْتُ مِنَ الظَّالِمِينَ ۚ ﴿٨٧﴾
فَاسْتَجَبْنَا لَهُ وَنَجَّيْنَاهُ مِنَ الْغَمِّ وَكَذٰلِكَ نُنْجِي الْمُؤْمِنِينَ ﴿٨٨﴾ وَزَكَرِيَّٓا اِذْ نَادٰى رَبَّهُ رَبِّ لَا تَذَرْنِي
فَرْدًا وَاَنْتَ خَيْرُ الْوَارِثِينَ ۚ ﴿٨٩﴾

---

laya düçar olmaqdan əlavə övladı və var-dövləti də tələf olmuşdu). **Ona övlad, bir o qədər də əlavə bəxş etdik.** (رَحْمَةً مِنْ عِنْدِنَا وَذِكْرٰى لِلْعَابِدِينَ) – (bununla) **dərgahımızdan ona rəhmət** (nemət bəxş edib, Mənə) **ibadət edənlərdən ötrü də öyüd-nəsihət verdik.**

**85)** (وَاِسْمٰعِيلَ وَاِدْرِيسَ وَذَا الْكِفْلِ كُلٌّ مِنَ الصَّابِرِينَ) - (bu 3 nəfəri peyğəmbər etmişdik, hamısı bizim yolumuzda məruz qaldıqları bəla və müsibətlərə) **səbir edənlərdən idilər,** (bəzi rəvayətlərə görə Zül-kifl İlyas peyğəmbərdir).

**86)** (وَاَدْخَلْنَاهُمْ فِي رَحْمَتِنَا اِنَّهُمْ مِنَ الصَّالِحِينَ) **- həqiqətən, saleh şəxslərdən olduqlarından onları rəhmətimizə qovuşdurduq.**

**87)** (وَذَا النُّونِ اِذْ ذَهَبَ مُغَاضِبًا فَظَنَّ اَنْ لَنْ نَقْدِرَ عَلَيْهِ) - (ey Məhəmməd, peyğəmbərlərimizdən) **Zünnunu** (balıq sahibi Yunisi də yad et)**, bir zaman** (qövmünə) **qəzəblənib,** (onları da qəzəbləndirib) **çıxıb getmiş, onu bəla və müsibətə düçar etməyəcəyimizi zənn etmişdi.** (Onun qövmü ona görə qəzəblənmişdi ki, Yunis onların arasından gedəndən sonra əzaba düçar olmaqdan qorxurdular. O da Allahdan izinsiz qövmünü tərk etdiyinə görə, cəzalandırılmayacağını güman etmişdi. Yunis Neynəva əhlinə peyğəmbər göndərilmişdi, onları imana dəvət etdi, lakin onların imana daxil olmalarından ümidini kəsəndən sonra qəzəblənib onlara əzab vədini verib oradan getdi. Lakin dənizə atılıb balığın qarnına düşdü). (فَنَادٰى فِي الظُّلُمَاتِ اَنْ لَٓا اِلٰهَ اِلَّٓا اَنْتَ) – (balığın qarnına düşəndə, balığın qarnında, dənizin, gecənin) **qaranlıqlarında Allah-Təalaya dua edib demişdi: "Səndən başqa heç bir** (haqq) **məbud yoxdur,** (yeganə müqəddəs zat, haqq məbud Allah-Təala sənsən). (سُبْحَانَكَ اِنِّي كُنْتُ مِنَ الظَّالِمِينَ) - (hər bir eyibdən və naqislikdən) **pak və müqəddəssən,** (qövmümün arasından səndən izinsiz getməklə) **həqiqətən, özümə zülm edənlərdən olmuşam.**

**88)** (فَاسْتَجَبْنَا لَهُ وَنَجَّيْنَاهُ مِنَ الْغَمِّ وَكَذٰلِكَ نُنْجِي الْمُؤْمِنِينَ) **- onun duasını qəbul edib** (balığın qarnındakı) **qəm-qüssədən onu xilas etdik.** (Yunisə nicat verdiyimiz kimi) **digər möminlərə də** (qəm-qüssədən) **nicat verdik.**

**89)** (وَزَكَرِيَّٓا اِذْ نَادٰى رَبَّهُ رَبِّ لَا تَذَرْنِي فَرْدًا وَاَنْتَ خَيْرُ الْوَارِثِينَ) – (ey Məhəmməd), **Zəkəriyyanı da** (yad et)**, bir zaman o rəbbi Allah-Təalaya dua edib demişdi: "Ey mənim rəbbim, məni tək-tənha** (övladsız) **etmə,** (mənə varis, övlad

فَاسْتَجَبْنَا لَهُۥ وَوَهَبْنَا لَهُ يَحْيٰى وَاَصْلَحْنَا لَهُ زَوْجَهُۜ اِنَّهُمْ كَانُوا يُسَارِعُونَ فِي الْخَيْرَاتِ وَيَدْعُونَنَا رَغَبًا وَرَهَبًاۜ وَكَانُوا لَنَا خَاشِعِينَ ﴿٩٠﴾ وَالَّتِي اَحْصَنَتْ فَرْجَهَا فَنَفَخْنَا فِيهَا مِنْ رُوحِنَا وَجَعَلْنَاهَا وَابْنَهَٓا اٰيَةً لِلْعَالَمِينَ ﴿٩١﴾ اِنَّ هٰذِهٖٓ اُمَّتُكُمْ اُمَّةً وَاحِدَةًۘ وَاَنَا رَبُّكُمْ فَاعْبُدُونِ ﴿٩٢﴾ وَتَقَطَّعُوٓا اَمْرَهُمْ بَيْنَهُمْۜ كُلٌّ اِلَيْنَا رَاجِعُونَ ﴿٩٣﴾

---

bəxş et, mənə varis verməsən də, qorxmaram)**, varislərin ən yaxşısı sənsən,** (cəmi məxluqata sən varis olacaqsan)**.”**

**90)** (فَاسْتَجَبْنَا لَهُ وَوَهَبْنَا لَهُ يَحْيٰى وَاَصْلَحْنَا لَهُ زَوْجَهُ) – (Zəkəriyyanın) **duasını qəbul edib, arvadını** (yaşlı olmasına baxmayaraq doğmağa) **qabil edib Yəhyanı ona bəxş etdik.** (اِنَّهُمْ كَانُوا يُسَارِعُونَ فِي الْخَيْرَاتِ) – (bu peyğəmbərlərin duasını ona görə qabil etdik ki,) **həqiqətən, onlar xeyir iş görməyə tələsərdilər.** (وَيَدْعُونَنَا رَغَبًا وَرَهَبًا وَكَانُوا لَنَا خَاشِعِينَ) - (ey Məhəmməd, bu qeyd olunan peyğəmbərlər bizim savabımıza) **ümid edib** (əzabımızdan) **qorxaraq bizə dua edərdilər və həmişə bizə qarşı qorxu içində olub,** (əzabımızdan xatircəm olmazdılar)**.**

**91)** (وَالَّتِي اَحْصَنَتْ فَرْجَهَا فَنَفَخْنَا فِيهَا مِنْ رُوحِنَا) – (bir də o saleh qadını - Məryəm yad et ki,) **bəkarətini qoruyub,** (ismətli olduğu halda) **biz öz ruhumuzdan ona üfləyib** (İsanı ona bəxş etdik. Atasız doğulan İsanı aləmlərdən ötrü möcüzə etdik)**.** (وَجَعَلْنَاهَا وَابْنَهَا اٰيَةً لِلْعَالَمِينَ) **Məryəmin özünü və oğlu İsanı aləmlərdən ötrü böyük əlamət qərar verdik ki, yalnız ondan atasız meydana gətirək.**

**92)** (اِنَّ هٰذِهٖٓ اُمَّتُكُمْ اُمَّةً وَاحِدَةً) **- həqiqətən,** (ey müsəlmanlar)**, bu** (islam) **ümməti sizin ümmətinizdir,** (digərlərindən seçilmiş, bəyənilmiş) **tək ümmətdir,** (ixtilaf edib ondan ayrılmayın)**.** (وَاَنَا رَبُّكُمْ فَاعْبُدُونِ) **- mən sizin rəbbiniz** (Allah-Təalayam)**, ancaq mənə ibadət edin.**

**93)** (وَتَقَطَّعُوٓا اَمْرَهُمْ بَيْنَهُمْ كُلٌّ اِلَيْنَا رَاجِعُونَ) **-** (bu ayə sanki bugünkü islam ümmətinin əhvalını xəbər verir, buyurur: islam ümməti dindən möhkəm yapışıb ittifaq etmək əvəzinə aralarındakı birliyi pozdular)**.* Öz aralarında** (təfriqə çıxarıb, bir-birilərinə lənət oxuyaraq kafir sayaraq) **firqələrə bölünüb,** (özlərini haqq, digərlərini batil hesab edirlər. Halbuki qiyamət günündə) **hamısı bizim tərəfimizə qayıdıb,** (bu əməllərinə görə cəzalandırılacaqlar, o gündən qafildirlər)**.**

*(*Qeyd: İlahi, İslam ümmətinin arasında olan bu ixtilaf və nifaqdan sənə pənah aparırıq, bu ixtilafların hamısı sənin kitabın Qurani-Şərifdən uzaqlaşdıqları üçün meydana gəlib. Əgər islam ümməti ittifaq edib, şəxsi fikirləri yerinə bir Allah-Təalaya, bir kitaba (Qurana), bir peyğəmbərə (Hz. Məhəmmədə) möhkəm yapışıb, digərlərini tərk etsələr, (necə ki islamın ilk dövrlərində belə idi) yenə islam ümməti birlik içində ola bilər. Bu, dərdin səbəbi cəhalətdir, cəhalət və nifaq islam ümmətini bürüyüb, hər ikisi də bir-birinə bağlıdır. Nifaqdan cəhalət, cəhalətdən nifaq yaranar, hər ikisinin*

فَمَنْ يَعْمَلْ مِنَ الصَّالِحَاتِ وَهُوَ مُؤْمِنٌ فَلَا كُفْرَانَ لِسَعْيِهٖۚ وَاِنَّا لَهُ كَاتِبُونَ ﴿٩٤﴾ وَحَرَامٌ عَلٰى قَرْيَةٍ
اَهْلَكْنَاهَآ اَنَّهُمْ لَا يَرْجِعُونَ ﴿٩٥﴾ حَتّٰٓى اِذَا فُتِحَتْ يَأْجُوجُ وَمَأْجُوجُ وَهُمْ مِنْ كُلِّ حَدَبٍ يَنْسِلُونَ
﴿٩٦﴾ وَاقْتَرَبَ الْوَعْدُ الْحَقُّ فَاِذَا هِيَ شَاخِصَةٌ اَبْصَارُ الَّذِينَ كَفَرُواۜ يَا وَيْلَنَا قَدْ كُنَّا فٖي غَفْلَةٍ مِنْ
هٰذَا بَلْ كُنَّا ظَالِمٖينَ ﴿٩٧﴾

---

*də dərmanı ancaq elm nuru ilə aydınlanmaqdadır. Hansı ölkədə elm və hikmət yayılsa, o millət nifaqdan kənar olub, ittifaqa meyil edər. Bu mətləb müsəlmanlarda da təcrübə olunur. Asiyanın qərbində mədəni millətlərlə qonşu olan müsəlman xalqlar az bir elmlə də olsa üzlərindəki cəhalət örtüsünü açdıqlarından aralarındakı nifaq və cəhalətin azalıb, birdəfəlik yox olacağına ümid edilir. Bunun əksinə, Orta Asiyada heç bir elm nuru pəncərəsi açılmayıb, hələ də Zülqərneyn səddinin fəthini, bir qulağı düşük, bir qulağı yorğan boyda olan Yəcuc-Məcucun gəlməsini gözləyib, dünya hadisələrindən əsla xəbərdar deyillər. Bəzi möminlər də ətrafında dəf çalanların dövr etdiyi, alnında tək gözü olan, 30 ağac uzunluğundakı eşşəyə minmiş Dəccalın gəlməsini, aləmə malik olmasını gözləyirlər. Belə qövmlərdən nicat ummaq imkansız işlərdəndir. Hz. Peyğəmbərin vəfatından hələ cəmi 1322 il keçibdir. Orta Asiya qövmlərinin arasında hələ də islamdan əvvəlki adətlər qalmaqdadır. Aralarında islam qanunlarından heç biri işlək deyil. Əgər onları bir-bir saysam, kitabın məzmunundan kənara çıxmış olarıq, lakin onları ağıl sahiblərinin idrakına həvalə etdim).*

**94)** (فَمَنْ يَعْمَلْ مِنَ الصَّالِحَاتِ وَهُوَ مُؤْمِنٌ فَلَا كُفْرَانَ لِسَعْيِهٖ) – **kim mömin olduğu halda yaxşı, gözəl əməllər etsə, əməli batil olmayıb** (əcrindən də məhrum olmaz)**.** (وَاِنَّا لَهُ كَاتِبُونَ) **- həqiqətən, biz onun əməllərini yazıb** (saxlayırıq ki, mükafatını ən gözəl şəkildə verək)**.**

**95)** (وَحَرَامٌ عَلٰى قَرْيَةٍ اَهْلَكْنَاهَآ اَنَّهُمْ لَا يَرْجِعُونَ) – (küfrləri səbəbinə) **məhv olmasını** (istədiyimiz) **məmləkət** (əhlinin) **qayıdıb** (imana daxil olması) **imkansızdır.** (Həqiqətən, onlar küfrlərindən qayıdıb Allah-Təalanın tərəfinə dönməzlər)**.**

**96)** (حَتّٰٓى اِذَا فُتِحَتْ يَأْجُوجُ وَمَأْجُوجُ وَهُمْ مِنْ كُلِّ حَدَبٍ يَنْسِلُونَ) – **hətta Yəcuc-Məcuc** (səddi) **açılıb, hər tərəfdən** (təpələrdən) **sürətlə axışıb** (dünyanın bir çox yerinə sahib olsalar da, kafirlər küfrlərindən qayıtmazlar, küfrləri daha da artar. Necə ki İsgəndər səddi Dərbənddə dağıdılıb, Yəcuc-Məcuc sayılan qövm də yer üzünə yayılıb sahib oldu, bu mətləb heç kimə məxfi deyil)**.**

**97)** (وَاقْتَرَبَ الْوَعْدُ الْحَقُّ) – (Allah bilir, onlar dünyaya sahib olandan nə qədər sonra) **haqq olan vəd** (qiyamət günü) **yaxınlaşdıqda,** (فَاِذَا هِيَ شَاخِصَةٌ اَبْصَارُ الَّذِينَ كَفَرُوا) – (o anda qiyamətin qorxusundan) **kafirlərin gözləri bərəlib** (kirpikləri örtülməz)**.** (يَا وَيْلَنَا قَدْ كُنَّا فٖي غَفْلَةٍ مِنْ هٰذَا بَلْ كُنَّا ظَالِمٖينَ) – (o vaxt da peşman olub deyərlər:) **vay halımıza,** (bugünkü günümüzdən) **qəflətdə idik. Xeyr,** (inkar etdiyimizdən) **zalım olmuşuq.**

اِنَّكُمْ وَمَا تَعْبُدُونَ مِنْ دُونِ اللّٰهِ حَصَبُ جَهَنَّمَ اَنْتُمْ لَهَا وَارِدُونَ ﴿٩٨﴾ لَوْ كَانَ هٰٓؤُلَٓاءِ اٰلِهَةً مَا وَرَدُوهَاۜ وَكُلٌّ فِيهَا خَالِدُونَ ﴿٩٩﴾ لَهُمْ فِيهَا زَفِيرٌ وَهُمْ فِيهَا لَا يَسْمَعُونَ ﴿١٠٠﴾ اِنَّ الَّذِينَ سَبَقَتْ لَهُمْ مِنَّا الْحُسْنٰٓىۙ اُولٰٓئِكَ عَنْهَا مُبْعَدُونَۙ ﴿١٠١﴾ لَا يَسْمَعُونَ حَسِيسَهَاۚ وَهُمْ فِي مَا اشْتَهَتْ اَنْفُسُهُمْ خَالِدُونَۚ ﴿١٠٢﴾ لَا يَحْزُنُهُمُ الْفَزَعُ الْاَكْبَرُ وَتَتَلَقّٰيهُمُ الْمَلٰٓئِكَةُۜ هٰذَا يَوْمُكُمُ الَّذِي كُنْتُمْ تُوعَدُونَ ﴿١٠٣﴾ يَوْمَ نَطْوِي السَّمَٓاءَ كَطَيِّ السِّجِلِّ لِلْكُتُبِۜ

---

**98)** (اِنَّكُمْ وَمَا تَعْبُدُونَ مِنْ دُونِ اللّٰهِ حَصَبُ جَهَنَّمَ اَنْتُمْ لَهَا وَارِدُونَ) – (ey Məkkə əhli müşriklər, sizdən əvvəlki müşriklərin əhvalı belədir. Amma siz müşriklərin əhvalı da elədir)**. Həqiqətən siz və Allah-Təaladan başqa ibadət etdiyiniz bütləriniz cəhənnəmin odunu və yanacağısınız, əlbəttə, cəhənnəmə varid olacaqsınız.**

**99)** (لَوْ كَانَ هٰٓؤُلَٓاءِ اٰلِهَةً مَا وَرَدُوهَا) **- əgər** (bu bütləriniz) **həqiqətən ilah olsaydılar,** (cəhənnəmə) **girməzdilər.** (وَكُلٌّ فِيهَا خَالِدُونَ) – (sizin bu məbudlarınız və onlara ibadət edən sizlər) **hamınız** (cəhənnəmdə) **əbədi** (əzab içində) **qalacaqsınız.**

**100)** (لَهُمْ فِيهَا زَفِيرٌ وَهُمْ فِيهَا لَا يَسْمَعُونَ) **-** (ey Məhəmməd, bu müşriklərdən ötrü cəhənnəmdə) **inləmək** (ah-nalə etmək) **var,** (amma Allah-Təala onların qulaqlarını kar etdiyindən bir-birilərinin) **naləsini orada eşitməzlər.**

**101)** (اِنَّ الَّذِينَ سَبَقَتْ لَهُمْ مِنَّا الْحُسْنٰٓى اُولٰٓئِكَ عَنْهَا مُبْعَدُونَ)**- həqiqətən, tərəfimizdən gözəl əcr və savabla müjdələnən** (möminlər)**, məhz onlar cəhənnəm odundan uzaq olarlar.**

**102)** (لَا يَسْمَعُونَ حَسِيسَهَا وَهُمْ فِي مَا اشْتَهَتْ اَنْفُسُهُمْ خَالِدُونَ) – (bu yad olunan şəxslər cəhənnəm alovunun) **səsini də eşitməyib,** (o cənnətdə) **canları istəyən ləzzətlər içində əbədi qalıb** (heç vaxt oradan çıxmazlar)**.**

**103)** (لَا يَحْزُنُهُمُ الْفَزَعُ الْاَكْبَرُ) – (qiyamət gününün) **böyük qorxusu** (cənnət əhlini) **qəmgin və məhzun etməz.** (Qiyamət gününün böyük qorxusunun səbəbi odur ki, haqq-hesab bitdikdən sonra kim cənnətlik, kim cəhənnəmlikdir, məlum olmaz. Bu səbəbdən insanlar həsrət və qorxu içində olarlar)**.** (وَتَتَلَقّٰيهُمُ الْمَلٰٓئِكَةُ هٰذَا يَوْمُكُمُ الَّذِي كُنْتُمْ تُوعَدُونَ) **- mələklər** (cənnət əhlinin) **qarşısına çıxıb onlara deyərlər: "Bu gün** (Allah-Təala tərəfindən dünyada) **sizə vəd olunan** (əcr və savab) **günüdür."** (Allah-Təalanın nemətləri sizə nuş olsun)**.**

**104)** (يَوْمَ نَطْوِي السَّمَٓاءَ كَطَيِّ السِّجِلِّ لِلْكُتُبِ) – (mələklərin Allah-Təalanın rəhmətiylə cənnət əhlini qarşılayacaqları gün) **o gündür ki, biz səmanı kitab səhifəsi kimi büküb qatlayarıq.** (Qiyamət günündə bu aləmdə hər bir şey pozulub məhv olacağı üçün səmanın məhv olması kağız kimi bükülüb bir tərəfə

كَمَا بَدَأْنَآ اَوَّلَ خَلْقٍ نُعِيدُهُ ۜ وَعْدًا عَلَيْنَاۜ اِنَّا كُنَّا فَاعِلِينَ ﴿١٠٤﴾ وَلَقَدْ كَتَبْنَا فِي الزَّبُورِ مِنْ بَعْدِ
الذِّكْرِ اَنَّ الْاَرْضَ يَرِثُهَا عِبَادِيَ الصَّالِحُونَ ﴿١٠٥﴾ اِنَّ فِي هٰذَا لَبَلَاغًا لِقَوْمٍ عَابِدِينَ ۜ ﴿١٠٦﴾ وَمَآ
اَرْسَلْنَاكَ اِلَّا رَحْمَةً لِلْعَالَمِينَ ﴿١٠٧﴾ قُلْ اِنَّمَا يُوحٰىٓ اِلَيَّ اَنَّمَآ اِلٰهُكُمْ اِلٰهٌ وَاحِدٌۚ فَهَلْ اَنْتُمْ مُسْلِمُونَ
﴿١٠٨﴾ فَاِنْ تَوَلَّوْا فَقُلْ اٰذَنْتُكُمْ عَلٰى سَوَآءٍۜ وَاِنْ اَدْرٖٓي اَقَرٖيبٌ اَمْ بَعٖيدٌ مَا تُوعَدُونَ ﴿١٠٩﴾

---

atılmaqla ifadə edilir). (كَمَا بَدَأْنَآ اَوَّلَ خَلْقٍ نُعِيدُهُ) - **necə ki** (insanları) **ilk dəfə** (yoxdan) **yaradıb dünyaya gətirdik,** (yox olandan sonra) **geri qaytarıb** (yenə dirildərik. Bizim üçün bu ikisinin arasında heç bir fərq yoxdur). (وَعْدًا عَلَيْنَاۜ اِنَّا كُنَّا فَاعِلِينَ) – (insanları dirildib məhşərə gətirmək) **vədi bizim öhdəmizdədir, mütləq edəcəyik.**

**105)** (وَلَقَدْ كَتَبْنَا فِي الزَّبُورِ مِنْ بَعْدِ الذِّكْرِ اَنَّ الْاَرْضَ يَرِثُهَا عِبَادِيَ الصَّالِحُونَ) - (ey Məhəmməd)**, həqiqətən, biz Tövratdan sonra Zəburda yazıb** (Davuda bildirdik ki, bu müqəddəs) **yerə** (Şama) **mənim saleh bəndələrim** (Hz. Məhəmmədin ümməti) **varis olacaqlar.** (Allah-Təalanın vədi doğru olub Bəni-İsrail bu müqəddəs torpaqdan çıxdı və Hz. Məhəmmədin ümməti Şama sahib oldular. Hz. Peyğəmbər bu ayənin məzmununa etimad edib xəbər verdi ki, məndən sonra Şamı fəth edərsiniz. Bu xəbər Hz. Peyğəmbərin haqq olduğuna bir dəlildir)**.**

**106)** (اِنَّ فِي هٰذَا لَبَلَاغًا لِقَوْمٍ عَابِدِينَ) **- bu** (surədə qeyd olunan xəbərlərdə) **Allah-Təalaya ibadət və itaət edən camaatdan ötrü** (kifayət qədər) **öyüd-nəsihət vardır.**

**107)** (وَمَآ اَرْسَلْنَاكَ اِلَّا رَحْمَةً لِلْعَالَمِينَ) **-** (ey Məhəmməd)**, biz səni ancaq aləmlərə bir rəhmət olsun deyə** (peyğəmbər) **göndərdik** (ki, insanlar sənə tabe olub, xoşbəxt olsunlar. Kim sənə tabe olmayıb asi olsa, o zillət onun özündəndir, yoxsa biz səni ancaq insanlara rəhmət və bərəkət olaraq göndərdik. Səndən insanlara bir zərər gəlməz)**.**

**108)** (قُلْ اِنَّمَا يُوحٰى اِلَيَّ اَنَّمَا اِلٰهُكُمْ اِلٰهٌ وَاحِدٌ) **-** (ey Məhəmməd, müşriklərə) **de ki, həqiqətən, mənə Allah-Təala tərəfindən belə vəhy olunub ki, həqiqətən, sizin məbudunuz tək, vahid Allah-Təaladır.** (فَهَلْ اَنْتُمْ مُسْلِمُونَ) **– bəs siz** (mənim sözümə, tövhidə) **tabe olub** (şirki tərk edib ancaq Allah-Təalaya ibadət və) **itaət edəcəksinizmi?**

**109)** (فَاِنْ تَوَلَّوْا فَقُلْ اٰذَنْتُكُمْ عَلٰى سَوَآءٍ) – (ey Məhəmməd)**, əgər səndən üz döndərib** (qulaq asmasalar)**, de ki,** (Allah-Təalanın hökmünü və tövhidini) **hamınıza bərabər bildirdim.** (Heç bir fərq qoymadım və heç kimdən gizlətmədim)**.** (وَاِنْ اَدْرٖٓي اَقَرٖيبٌ اَمْ بَعٖيدٌ مَا تُوعَدُونَ) – (Allah-Təalanın) **sizə vəd etdiyi**

اِنَّهُ يَعْلَمُ الْجَهْرَ مِنَ الْقَوْلِ وَيَعْلَمُ مَا تَكْتُمُونَ ﴿١١٠﴾ وَاِنْ اَدْر۪ي لَعَلَّهُ فِتْنَةٌ لَكُمْ وَمَتَاعٌ اِلٰى ح۪ينٍ
﴿١١١﴾ قَالَ رَبِّ احْكُمْ بِالْحَقِّۜ وَرَبُّنَا الرَّحْمٰنُ الْمُسْتَعَانُ عَلٰى مَا تَصِفُونَ ﴿١١٢﴾

---

**şeyin** (islamın qalib, kafirlərin zəlil olmasının) **yaxın, ya da uzaq olduğunu bilmirəm.**

**110)** (اِنَّهُ يَعْلَمُ الْجَهْرَ مِنَ الْقَوْلِ وَيَعْلَمُ مَا تَكْتُمُونَ) **- həqiqətən, Allah-Təala aşkar dediyinizi də, gizlətdiyinizi də bilir,** (heç bir şey Onun elmindən kənar deyil)**.**

**111)** (وَاِنْ اَدْر۪ي لَعَلَّهُ فِتْنَةٌ لَكُمْ وَمَتَاعٌ اِلٰى ح۪ينٍ) **-** (Hz. Peyğəmbər deyir: ey müşriklər)**, mən bilmirəm, bəlkə də** (Allah-Təalanın vəd etdiyi əzabın təxirə salınması) **sizi imtahan etmək və müəyyən vaxta qədər** (əcəl gününə qədər dünyadan) **ləzzət almanız üçündür.**

**112)** (قَالَ رَبِّ احْكُمْ بِالْحَقِّ) **-** (Hz. Peyğəmbər müşriklərə xitab edib qurtardıqdan sonra dua edib) **dedi: ey mənim rəbbim,** (mənimlə bu müşriklərin arasında) **haqq və ədalətlə hökm et,** (haqları olan cəzalarını ver)**.** (وَرَبُّنَا الرَّحْمٰنُ الْمُسْتَعَانُ عَلٰى مَا تَصِفُونَ) – (müşriklər Hz. Peyğəmbərə deyirdilər: “Şövkət və qələbə bizə nəsib olub, sənə qalib olacağıq.” Hz. Peyğəmbər onların cavabında buyurdu:) **Rəbbimiz Rəhman olan Allah-Təaladır. Dediklərinizə qarşı yardımı ümid edilən də Odur.** (Allah-Təalanın yardımı ilə sizə qalib gələcəyik. Sizin sözləriniz də batildir)**.**

Həmd olsun, Ənbiya surəsinin təfsiri bitdi. İbrət alan bir qəlb lazımdır ki, bu mübarək surədə qeyd olunan qissə və nəsihətlərdən ibrət alıb insanlıq aləminə daxil olsun. Böyük səadət Qurani-Şərifin dərin mənalarını dərk edib, onun ədəbi ilə ədəblənməkdədir. Hz. peyğəmbər buyurubdur: “Ənbiya surəsini kim oxuyub, onun ayələrini təfəkkür etsə, Allah-Təala qiyamət günündə onu asan sorğu-sual edər.” (Qazi Beyzavi, Ənvarut-Tənzil, IV/285)



## əl-HƏCC SURƏSİ

22-ci surədir. Məkkədə nazil olub, 78 ayə, 1291 kəlmə, 5075 hərfdir.



بِسْمِ اللهِ الرَّحْمٰنِ الرَّحِيمِ. يَآ اَيُّهَا النَّاسُ اتَّقُوا رَبَّكُمْ اِنَّ زَلْزَلَةَ السَّاعَةِ شَيْءٌ عَظِيمٌ ﴿١﴾ يَوْمَ تَرَوْنَهَا
تَذْهَلُ كُلُّ مُرْضِعَةٍ عَمَّآ اَرْضَعَتْ وَتَضَعُ كُلُّ ذَاتِ حَمْلٍ حَمْلَهَا

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1)** (يَآ اَيُّهَا النَّاسُ اتَّقُوا رَبَّكُمْ) **- ey insanlar, rəbbiniz Allah-Təalanın** (əzabından) **qorxub** (Onun itaət və ibadətindən çıxmayın)**.** (اِنَّ زَلْزَلَةَ السَّاعَةِ شَيْءٌ عَظِيمٌ) **- həqiqətən, qiyamət gününün zəlzələsi* böyük** (müdhiş) **şeydir.**

**2)** (يَوْمَ تَرَوْنَهَا تَذْهَلُ كُلُّ مُرْضِعَةٍ عَمَّآ اَرْضَعَتْ) – (o zəlzələ elə şiddətli zəlzələdir ki,) **o gün hər bir əmzikli qadın əmizdirdiyi uşağı** (qorxudan) **unudar.** (وَتَضَعُ كُلُّ ذَاتِ حَمْلٍ حَمْلَهَا) **- hər bir hamilə qadın** (qorxudan) **uşağını düşürər.**

*(*__Qeyd:__ Dünyada insanlar üçün ən qorxulu və dəhşətli hadisə zəlzələ olduğundan Allah-Təala qiyamət günündəki zəlzələ ilə insanları qorxudur. Belə ki, insanlar zəlzələnin dəhşətini təsəvvürə gətirib, o günün şiddət və qorxuncluğundan nəfslərini saxlayıb, Allah-Təalaya itaət edib onun əmr və qadağalarını özlərinə vacib bilib, heyvani xüsusiyyətləri tərk edib üstün insanlıq xüsusiyyətlərinə qovuşmağı özlərinə fərz və lazım bilsinlər. Allah-Təalanın iki qamçısı var: birincisi - müjdə vermək, digəri - qorxutmaqdır, bu iki qamçı ilə Allah-Təala kamil insan (peyğəmbər) vasitəsilə insanları cəhalət və heyvanlıqdan insanlıq və mələklik xüsusiyyətlərini qazanmağa sövq edir. Necə ki ata oğlunu məktəbə və elm öyrənməyə göndərəndə uşağın təbiəti oyun və əyləncəyə, zəhmətdən qaçmağa meyilli olduğundan ata öz uşağını məktəbə getməyə təşviq etməkdən ötrü ona gah müjdə verib deyər ki, sənə gözəl şeylər alacağam.* که به رو کتاب مراغت با موعظ و فسطق اورم *Ya da qorxudub deyər ki, səni döyərəm və ya paltar almaram, belə sözlərlə uşağı məktəbə getməyə, özünü kamilləşdirməyə vadar edər. Aralarındakı fərq bundadır ki, Allah-Təalanın vədi haqdır. Amma atanın bəzi vədləri yalan olsa da, zərəri yoxdur. Bizim işimiz də belədir, Allah-Təala müjdə və qorxutmaqla 40, 50 və ya 60 yaşındakı biz uşaqları da özümüzü kamilləşdirməyə zorla vadar edir. Amma elm nuru ilə aydınlanan qəlblər bu iki qamçıya ehtiyac olmadan iman nuru ilə insanlıq aləminə daxil olub, saflaşarlar. Necə ki əmirəl-möminin Hz. Əli belə dua edir. "İlahi, cəhənnəm qorxusundan və cənnət tamahı ilə sənə ibadət etmirəm, bəlkə, səni ibadət və itaətə layiq gördüyüm üçün ibadət edirəm." Allah-Təalanın peyğəmbər göndərməkdə məqsədi xalqı imana dəvət edib, onları vəhşilik və cəhalətdən qurtarıb elm və kamala qovuşdurmaqdır. Hz. Məhəmmədin parlaq şəriətində əmr edilən hər bir ibadətin məqsədi insanı elm sahibi edib kamilləşdirməkdir. Amma bizim islam ümməti*

وَتَرَى النَّاسَ سُكَارٰى وَمَا هُمْ بِسُكَارٰى وَلٰكِنَّ عَذَابَ اللّٰهِ شَدٖيدٌ ﴿٢﴾ وَمِنَ النَّاسِ مَنْ يُجَادِلُ فِي اللّٰهِ بِغَيْرِ عِلْمٍ وَيَتَّبِعُ كُلَّ شَيْطَانٍ مَرٖيدٍ ﴿٣﴾ كُتِبَ عَلَيْهِ اَنَّهُ مَنْ تَوَلَّاهُ فَاَنَّهُ يُضِلُّهُ وَيَهْدٖيهِ اِلٰى عَذَابِ السَّعٖيرِ ﴿٤﴾ يَٓا اَيُّهَا النَّاسُ اِنْ كُنْتُمْ فٖي رَيْبٍ مِنَ الْبَعْثِ فَاِنَّا خَلَقْنَاكُمْ مِنْ تُرَابٍ ثُمَّ مِنْ نُطْفَةٍ ثُمَّ مِنْ عَلَقَةٍ ثُمَّ مِنْ مُضْغَةٍ مُخَلَّقَةٍ وَغَيْرِ مُخَلَّقَةٍ

---

*əsl həqiqi mətləbdən qafil olub zəlalət vadisində çaşqın və sərgərdan qalıblar. Məsələn, bəzi müsəlmanlar möminliklərini izhar etmək üçün namazı məsciddə camaatla qılıb, nurlu şəriətin əmr etdiyi kimi, bunu tərk etməməyi özlərinə vacib sayırlar və çox sevinirlər ki, Allah-Təalanın əmrinə itaət edib ona müxalif olmayıblar. Amma biçarələr namazın əsl mənasından qafil olub, bilmirlər ki, əsl namaz namaz qılan şəxsi xəbis əməllərdən saxlayıb mələkləşdirməlidir. Necə ki "Həqiqətən, namaz (insanı) çirkin və pis əməllərdən çəkindirər", ayəsində bəyan edilib, amma o biçarələr namaz qılmalarına aldanıb zülm, mərdiməzarlıq, camaatın malını qəsb etmək, insan öldürmək və ya buna fitva vermək, zalıma kömək etmək, ya da yalandan şəhadət etmək kimi şeyləri də özlərinə şüar edib, bu əməllərlə yanaşı namaz qılır, ya da məscidlərdə mərsiyəyə qulaq asıb ağlamaqla pak olduqlarını zənn edirlər. Məgər Qurani-Şərif, ya da Hz. Peyğəmbər belə əmr edib? Namaz ayəsində belə buyurulub? Onun məzmununa diqqət edəndə məlum olur ki, biz namaz qılan deyilik, Hz. Peyğəmbər buyurubdur: "İçinizdən Allaha ən yaxın olan kəs məxluqata zülm etməyib, özünə istəmədiyini başqasına da rəva görməyəndir." Həqiqətən, diqqətlə baxanda bizdə müsəlmanlığın adından başqa islami bir şey qalmayıbdır. Bir az təfəkkür edin).*

(وَتَرَى النَّاسَ سُكَارٰى) - (ey Məhəmməd, o gün zəlzələnin qorxusundan) **insanları sərxoş görərsən.** (وَمَا هُمْ بِسُكَارٰى وَلٰكِنَّ عَذَابَ اللّٰهِ شَدٖيدٌ) - **onlar sərxoş deyildirlər, lakin Allah-Təalanın əzabının şiddətindən** (qorxduqlarından elə görünürlər)**.**

**3)** (وَمِنَ النَّاسِ مَنْ يُجَادِلُ فِي اللّٰهِ بِغَيْرِ عِلْمٍ) - (ey Məhəmməd)**, insanlardan bəzisi var ki, elmləri** (dəlil-sübutları) **olmadığı halda, Allah-Təala haqqında mübahisə edirlər.** (وَيَتَّبِعُ كُلَّ شَيْطَانٍ مَرٖيدٍ) – **və asi** (fəsadçı) **şəxslərə tabe olurlar.**

**4)** (كُتِبَ عَلَيْهِ اَنَّهُ مَنْ تَوَلَّاهُ فَاَنَّهُ يُضِلُّهُ وَيَهْدٖيهِ اِلٰى عَذَابِ السَّعٖيرِ) – (şeytan və fəsadçı şəxslər barəsində hökm olunub) **yazılıbdır ki, kim onunla dost olsa, həqiqətən, o şəxsi zəlalətə salıb** (atəşli cəhənnəmə aparar)**.**

**5)** (يَٓا اَيُّهَا النَّاسُ اِنْ كُنْتُمْ فٖي رَيْبٍ مِنَ الْبَعْثِ) - **ey insanlar, əgər** (öləndən sonra qiyamət günündə) **diriləcəyinizə şübhə edirsinizsə,** (sizə tabe olacağınız bir dəlili bəyan edim)**.** (فَاِنَّا خَلَقْنَاكُمْ مِنْ تُرَابٍ) – (o dəlil budur:) **həqiqətən, biz sizi** (babanız Adəmi) **torpaqdan yaratdıq.** (ثُمَّ مِنْ نُطْفَةٍ) **- ondan sonra sizi spermadan** (yaratdıq)**.** (ثُمَّ مِنْ عَلَقَةٍ) **- ondan sonra bir parça qandan** (yəni spermanı döndərib bir parça qan etdik)**,** (ثُمَّ مِنْ مُضْغَةٍ) **- ondan sonra bir parça ətdən,** (yəni qanı döndərib bir parça ət etdik)**,** (مُخَلَّقَةٍ وَغَيْرِ مُخَلَّقَةٍ) **- bəzisini tam, bəzisini naqis** (yaratdıq)**.** (Bu səbəbdən insanlar bir-birilərindən fərqli olub,

لِنُبَيِّنَ لَكُمْ ۚ وَنُقِرُّ فِي الْاَرْحَامِ مَا نَشَٓاءُ اِلٰٓى اَجَلٍ مُسَمًّى ثُمَّ نُخْرِجُكُمْ طِفْلًا ثُمَّ لِتَبْلُغُوٓا اَشُدَّكُمْ ۚ
وَمِنْكُمْ مَنْ يُتَوَفّٰى وَمِنْكُمْ مَنْ يُرَدُّ اِلٰٓى اَرْذَلِ الْعُمُرِ لِكَيْلَا يَعْلَمَ مِنْ بَعْدِ عِلْمٍ شَيْـًٔا ۜ وَتَرَى الْاَرْضَ
هَامِدَةً فَاِذَٓا اَنْزَلْنَا عَلَيْهَا الْمَٓاءَ اهْتَزَّتْ وَرَبَتْ وَاَنْبَتَتْ مِنْ كُلِّ زَوْجٍ بَه۪يجٍ ﴿٥﴾ ذٰلِكَ بِاَنَّ اللّٰهَ هُوَ الْحَقُّ
وَاَنَّهُ يُحْيِ الْمَوْتٰى وَاَنَّهُ عَلٰى كُلِّ شَيْءٍ قَد۪يرٌ ﴿٦﴾ وَاَنَّ السَّاعَةَ اٰتِيَةٌ لَا رَيْبَ ف۪يهَا ۙ وَاَنَّ اللّٰهَ يَبْعَثُ مَنْ
فِي الْقُبُورِ ﴿٧﴾ وَمِنَ النَّاسِ مَنْ يُجَادِلُ فِي اللّٰهِ بِغَيْرِ عِلْمٍ وَلَا هُدًى وَلَا كِتَابٍ مُن۪يرٍ ﴿٨﴾

---

bəziləri yaraşıqlı, qədd-qamətli, bəziləri çirkin, qısaboy, qüsurlu olurlar. Allah-Təala öz hikməti ilə hər kəsi bir şəkildə yaradıb). (لِنُبَيِّنَ لَكُمْ) – (siz insanları bir haldan başqa bir hala, bir təbiətdən başqa bir təbiətə keçirdik ki, qüdrət və hikmətimizi) **sizə bəyan edək.** (وَنُقِرُّ فِي الْاَرْحَامِ مَا نَشَٓاءُ اِلٰٓى اَجَلٍ مُسَمًّى) – **istədiyimiz** (hər bir spermanı) (anaların) **rəhmlərində müəyyən bir vaxta kimi** (döl olana kimi) **tutub saxlayarıq.** (ثُمَّ نُخْرِجُكُمْ طِفْلًا) **- ondan sonra** (doğuş tamam olanda) **körpə olduğunuz halda, sizi** (ananızın bətnindən) **çıxardarıq.** (ثُمَّ لِتَبْلُغُوٓا اَشُدَّكُمْ) **- ondan sonra yetişkin** (ağıl və güc sahibi) **olmanız üçün** (sizə tərbiyə verib mühafizə edərik). (وَمِنْكُمْ مَنْ يُتَوَفّٰى) - (Allah-Təala məsləhət görüb vaxtından qabaq) **bəzinizi vəfat etdirər.** (وَمِنْكُمْ مَنْ يُرَدُّ اِلٰٓى اَرْذَلِ الْعُمُرِ) – **bəzinizi də ömrünün ən zəif** (rəzil qocalıq) **halına qədər çatdırar.** (لِكَيْلَا يَعْلَمَ مِنْ بَعْدِ عِلْمٍ شَيْـًٔا) – **ki, bir şey bildiyi halda, sonra** (unudub) **bilməz.** (Məsələn, bildiyini az sonra unudub yenidən soruşar. Təkrar bir də soruşar. Bu ayədə zikr olunanlar insanın qiyamət günündə diriləcəyinə bir dəlildir. 2-ci sıradakı ayədə zikr olunur)**.** (وَتَرَى الْاَرْضَ هَامِدَةً) – (ey məhşəri və qiyaməti inkar edənlər)**, yeri qupquru** (otsuz, ələfsiz) **görərsən.** (فَاِذَٓا اَنْزَلْنَا عَلَيْهَا الْمَٓاءَ اهْتَزَّتْ وَرَبَتْ) – (o ölü yerə səmadan) **su endirdikdə,** (çıxan otun, ələfin səbəbinə) **hərəkət edib qabarar,** (sanki canlanıb dirilər). (وَاَنْبَتَتْ مِنْ كُلِّ زَوْجٍ بَه۪يجٍ) – (ondan sonra o suyun səbəbinə yer hər kəsi) **şad edən hər cür bitkilər yetişdirər.**

**6)** (ذٰلِكَ بِاَنَّ اللّٰهَ هُوَ الْحَقُّ) **- bu** (insanların yaradılması və öldükdən sonra yerin canlanmasının zikr edilməsi) **ona görədir ki, Allah-Təala haqq olan məbuddur.** (وَاَنَّهُ يُحْيِ الْمَوْتٰى وَاَنَّهُ عَلٰى كُلِّ شَيْءٍ قَد۪يرٌ) **- və hər bir şeyə qadirdir,** (sizi ilk dəfə yaratmağa qadir olduğu kimi, öldükdən sonra da diriltməyə qadirdir)**.**

**7)** (وَاَنَّ السَّاعَةَ اٰتِيَةٌ لَا رَيْبَ ف۪يهَا) **- həqiqətən, qiyamətin gələcəyinə heç bir şəkk-şübhə yoxdur.** (وَاَنَّ اللّٰهَ يَبْعَثُ مَنْ فِي الْقُبُورِ) **- həqiqətən, Allah-Təala qəbirdəki** (ölüləri) **diriildib** (məhşərə gətirər)**.**

**8)** (وَمِنَ النَّاسِ مَنْ يُجَادِلُ فِي اللّٰهِ بِغَيْرِ عِلْمٍ وَلَا هُدًى وَلَا كِتَابٍ مُن۪يرٍ) - (ey Məhəmməd, müşriklərdən) **elələri var ki, elmləri, dəlil-sübutları, nurlu** (vəhy) **kitabları olmadan Allah-Təala** (və onun kitabı) **haqqında mübahisə edib** (şərik qoşur və tövhidi inkar edirlər. Bu ayə və bundan sonrakı ayə Əbu Cəhl ibn Hişam və onun kimi olanlar haqqında nazil olubdur)**.**

ثَانِيَ عِطْفِهٖ لِيُضِلَّ عَنْ سَبِيلِ اللّٰهِۜ لَهُ فِي الدُّنْيَا خِزْيٌ وَنُذِيقُهُ يَوْمَ الْقِيٰمَةِ عَذَابَ الْحَرِيقِ ﴿٩﴾ ذٰلِكَ
بِمَا قَدَّمَتْ يَدَاكَ وَاَنَّ اللّٰهَ لَيْسَ بِظَلَّامٍ لِلْعَبِيدِ ﴿١٠﴾ وَمِنَ النَّاسِ مَنْ يَعْبُدُ اللّٰهَ عَلٰى حَرْفٍۚ فَاِنْ اَصَابَهُ
خَيْرٌ اطْمَاَنَّ بِهٖۚ وَاِنْ اَصَابَتْهُ فِتْنَةٌ انْقَلَبَ عَلٰى وَجْهِهٖۚ خَسِرَ الدُّنْيَا وَالْاٰخِرَةَۜ ذٰلِكَ هُوَ الْخُسْرَانُ الْمُبِينُ
﴿١١﴾ يَدْعُوا مِنْ دُونِ اللّٰهِ مَا لَا يَضُرُّهُ وَمَا لَا يَنْفَعُهُۜ ذٰلِكَ هُوَ الضَّلَالُ الْبَعِيدُ ﴿١٢﴾

---

**9)** (ثَانِيَ عِطْفِهٖ لِيُضِلَّ عَنْ سَبِيلِ اللّٰهِ) **-** (Əbu Cəhl Allah-Təala tərəfinə dəvət edildikdə təkəbbüründən peyğəmbərdən üz döndərib)**, boynunu əyərək** (Allah-Təala haqqında mübahisə edər ki, insanları da) **Allahın yolundan çıxarıb** (zəlalətə salsın)**.** (لَهُ فِي الدُّنْيَا خِزْيٌ) **-** (bu Əbu Cəhldən) **ötrü dünyada zəlillik vardır.** (Bədir savaşında zillət içində öldürüldü)**.** (وَنُذِيقُهُ يَوْمَ الْقِيٰمَةِ عَذَابَ الْحَرِيقِ)**- qiyamət günündə də ona yandırıcı odun əzabını dadızdırarıq** (ki, heç vaxt o əzabdan xilas ola bilməsin)**.**

**10)** (ذٰلِكَ بِمَا قَدَّمَتْ يَدَاكَ) – (qiyamət günündə Əbu Cəhlə deyilər:) **bu** (əzab dünyada) **əllərinlə qazandığın** (günah əməllər) **səbəbinədir.** (Yəni bu əzabın səbəbi etdiyin küfr, şər və digər qəbih əməllərə görədir)**.** (وَاَنَّ اللّٰهَ لَيْسَ بِظَلَّامٍ لِلْعَبِيدِ) **- həqiqətən, Allah-Təala** (məsum) **bəndələrinə heç vaxt zülm edib** (əzab verən) **deyildir.** (Hər kəsə öz etdiyi günaha görə cəza verər)**.**

**11)** (وَمِنَ النَّاسِ مَنْ يَعْبُدُ اللّٰهَ عَلٰى حَرْفٍ) **– insanlardan eləsi də var ki, zahirdə Allah-Təalaya ibadət edər,** (yəni istəmədiyi halda, müsəlman kimi görünər. Məsələn, bir ordu savaşanda elə şəxslər olur ki, dayanıb kənardan baxarlar, əgər qoşun qalib gəlsə, özünü qoşunun arasına salıb, qənimətdə şərik olar, sevindiklərini göstərərlər, amma qoşun məğlub olsa, oradan qaçıb gedərlər. Bu şəxslər də belədir. Bu ayə bəzi bədəvi ərəblər haqqında nazil olub, hansı ki peyğəmbərə iman gətirdikdən sonra baxardılar, əgər heyvanları sağ-salamat doğub balaları yaşasaydı, arvadları onlara oğul doğub özləri də ölməsəydi, deyirdilər ki, bu islam dini əcəb gözəl dindir. Amma əgər heyvanlarının balaları ölüb, arvadları da qız doğub, özləri də xəstələnsəydilər, deyirdilər ki, bu din nə pis dindir, dönüb bütpərəst olurdular. Bu ayədə Allah-Təala onların islama daxil olandan sonrakı hallarını xəbər verir)**.** (فَاِنْ اَصَابَهُ خَيْرٌ اطْمَاَنَّ بِهٖ) **- əgər** (bu ərəblərə) **bir xeyir toxunsa,** (bu səbəbdən) **arxayın olub** (islamdan razı qalarlar)**.** (وَاِنْ اَصَابَتْهُ فِتْنَةٌ انْقَلَبَ عَلٰى وَجْهِهٖ) **- əgər onlara** (və ya mal və övladlarına) **bir bəla** (və müsibət) **toxunsa, sifəti dəyişər,** (islamdan çıxıb deyər: "Bu islam nə pis dindir")**.** (خَسِرَ الدُّنْيَا وَالْاٰخِرَةَ) **- belə şəxs dünya və axirətdə də özünə zərər verər.** (Dünyada mürtəd olduğu üçün öldürülmə, axirətdə əbədi əzab içində qalma cəzası verilər)**.** (ذٰلِكَ هُوَ الْخُسْرَانُ الْمُبِينُ) – (dünya və axirətdə) **açıq-aşkar zərərdə olmaq budur.**

**12)** (يَدْعُوا مِنْ دُونِ اللّٰهِ مَا لَا يَضُرُّهُ وَمَا لَا يَنْفَعُهُ) – (bu şəxs mürtəd olandan sonra) **Allahı qoyub ona nə zərər, nə də xeyir verməyən bir şeyə** (bütə) **ibadət edər,** (ذٰلِكَ هُوَ الضَّلَالُ الْبَعِيدُ) – (haqdan) **uzaq edən zəlalət də budur.**

يَدْعُوا لَمَنْ ضَرُّهُ اَقْرَبُ مِنْ نَفْعِهٖۜ لَبِئْسَ الْمَوْلٰى وَلَبِئْسَ الْعَش۪يرُ ﴿١٣﴾ اِنَّ اللّٰهَ يُدْخِلُ الَّذ۪ينَ اٰمَنُوا وَعَمِلُوا
الصَّالِحَاتِ جَنَّاتٍ تَجْر۪ي مِنْ تَحْتِهَا الْاَنْهَارُۜ اِنَّ اللّٰهَ يَفْعَلُ مَا يُر۪يدُ ﴿١٤﴾ مَنْ كَانَ يَظُنُّ اَنْ لَنْ يَنْصُرَهُ اللّٰهُ
فِي الدُّنْيَا وَالْاٰخِرَةِ فَلْيَمْدُدْ بِسَبَبٍ اِلَى السَّمَٓاءِ ثُمَّ لْيَقْطَعْ فَلْيَنْظُرْ هَلْ يُذْهِبَنَّ كَيْدُهُ مَا يَغ۪يظُ ﴿١٥﴾ وَكَذٰلِكَ
اَنْزَلْنَاهُ اٰيَاتٍ بَيِّنَاتٍۙ وَاَنَّ اللّٰهَ يَهْد۪ي مَنْ يُر۪يدُ ﴿١٦﴾ اِنَّ الَّذ۪ينَ اٰمَنُوا وَالَّذ۪ينَ هَادُوا وَالصَّابِـ۪ٔينَ وَالنَّصَارٰى
وَالْمَجُوسَ وَالَّذ۪ينَ اَشْرَكُواۗ اِنَّ اللّٰهَ يَفْصِلُ بَيْنَهُمْ يَوْمَ الْقِيٰمَةِۜ اِنَّ اللّٰهَ عَلٰى كُلِّ شَيْءٍ شَه۪يدٌ ﴿١٧﴾

---

**13)** (يَدْعُوا لَمَنْ ضَرُّهُٓ اَقْرَبُ مِنْ نَفْعِهٖ) - (elə bir bütə) **dua edib** (ibadət edər ki,) **onun zərəri mənfəətindən çoxdur.** (Bütpərəstlik etiqadına görə o bütlər qiyamət günü onlara şəfaət edəcək. Qiyamət günü isə o bütlərin şəfaət edə bilməyib, ancaq zərər verdiyini görərlər). (لَبِئْسَ الْمَوْلٰى وَلَبِئْسَ الْعَش۪يرُ) – (o bütlər) **nə pis yoldaş və nə pis köməkçidir,** (onlara ibadət edənlərə heç bir mənfəət verməzlər)**.**

**14)** (اِنَّ اللّٰهَ يُدْخِلُ الَّذ۪ينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ جَنَّاتٍ تَجْر۪ي مِنْ تَحْتِهَا الْاَنْهَارُ) **- həqiqətən, Allah-Təala iman gətirib saleh əməl edənləri** (qəsrlərinin və ağaclarının) **altından çaylar axan** (cənnət) **bağlarına daxil edər,** (اِنَّ اللّٰهَ يَفْعَلُ مَا يُر۪يدُ) **- həqiqətən, Allah-Təala istədiyini edər,** (Ona itaət edənlərə lütf, günah edənlərə əzab edər, heç kim Ona mane ola bilməz)**.**

**15)** (مَنْ كَانَ يَظُنُّ اَنْ لَنْ يَنْصُرَهُ اللّٰهُ فِي الدُّنْيَا وَالْاٰخِرَةِ) – (müşriklərdən) **kim güman etsə ki, Allah-Təala** (peyğəmbərinə) **dünyada kömək etməyib, axirətdə də** (ona uca dərəcələr verməyib, intiqamını almayacaq, bu zənni batildir. Allah-Təala bunun əksini edib dünya və axirətdə peyğəmbərinə kömək olacaqdır)**.** (فَلْيَمْدُدْ بِسَبَبٍ اِلَى السَّمَٓاءِ ثُمَّ لْيَقْطَعْ) – (kim peyğəmbərə düşmən olub ona qəzəblənsə)**, qoy evinin tavanından bir ip asıb, sonra** (boğazına salıb) **kəssin,** (özünü boğsun)**.** (فَلْيَنْظُرْ هَلْ يُذْهِبَنَّ كَيْدُهُ مَا يَغ۪يظُ) – **qoy görsün ki, hiyəsi qəzəbləndiyi bu şeyi** (Allahın peyğəmbərinə yardım etməsini) **dəf edə bilirmi?** (Əlbəttə, dəf edə bilməz. Elə şəxslərin ölməsi yaxşıdır)**.**

**16)** (وَكَذٰلِكَ اَنْزَلْنَاهُ اٰيَاتٍ بَيِّنَاتٍ) – **beləliklə** (zikr olunan bu Quranın hamısını tövhid və qüdrətimizə işarə edən) **açıq-aşkar dəlil və sübutla nazil etmişik.** (وَاَنَّ اللّٰهَ يَهْد۪ي مَنْ يُر۪يدُ) **- Allah-Təala istədiyi şəxslərə** (möminlərə bu Quranın səbəbinə) **hidayət edər.**

**17)** (اِنَّ الَّذ۪ينَ اٰمَنُوا وَالَّذ۪ينَ هَادُوا وَالصَّابِـ۪ٔينَ وَالنَّصَارٰى وَالْمَجُوسَ وَالَّذ۪ينَ اَشْرَكُوا اِنَّ اللّٰهَ يَفْصِلُ بَيْنَهُمْ يَوْمَ الْقِيٰمَةِ) **- həqiqətən, Allah-Təala qiyamət günü** (Qurani-Şərifə) **iman gətirənləri, yəhudiləri, sabiiləri** (mələklərə sitayiş edənlər)**, xristianları, atəşpərəstləri və müşrikləri bir-birindən ayırıb,** (hər biri haqqında ayrı hökm və cəza verər)**.** (اِنَّ اللّٰهَ عَلٰى كُلِّ شَيْءٍ شَه۪يدٌ) **- həqiqətən, Allah-Təala hər bir**

اَلَمْ تَرَ اَنَّ اللّٰهَ يَسْجُدُ لَهُ مَنْ فِي السَّمٰوَاتِ وَمَنْ فِي الْاَرْضِ وَالشَّمْسُ وَالْقَمَرُ وَالنُّجُومُ وَالْجِبَالُ وَالشَّجَرُ وَالدَّوَٓابُّ وَكَثِيرٌ مِنَ النَّاسِ وَكَثِيرٌ حَقَّ عَلَيْهِ الْعَذَابُ وَمَنْ يُهِنِ اللّٰهُ فَمَا لَهُ مِنْ مُكْرِمٍ اِنَّ اللّٰهَ يَفْعَلُ مَا يَشَٓاءُ ﴿١٨﴾ هٰذَانِ خَصْمَانِ اخْتَصَمُوا فِي رَبِّهِمْ فَالَّذِينَ كَفَرُوا قُطِّعَتْ لَهُمْ ثِيَابٌ مِنْ نَارٍ يُصَبُّ مِنْ فَوْقِ رُؤُسِهِمُ الْحَمِيمُ ﴿١٩﴾ يُصْهَرُ بِهِ مَا فِي بُطُونِهِمْ وَالْجُلُودُ ﴿٢٠﴾ وَلَهُمْ مَقَامِعُ مِنْ حَدِيدٍ ﴿٢١﴾ كُلَّمَا اَرَادُوا اَنْ يَخْرُجُوا مِنْهَا مِنْ غَمٍّ اُعِيدُوا فِيهَا

---

**şeyə** (agah və) **şahiddir,** (heç bir şey onun elmindən kənarda qalmayıb, heç kimə zülm etməyib, hər kəslə öz əməlinə görə rəftar edəcəkdir)**.**

**18)** (اَلَمْ تَرَ اَنَّ اللّٰهَ يَسْجُدُ لَهُ مَنْ فِي السَّمٰوَاتِ وَمَنْ فِي الْاَرْضِ وَالشَّمْسُ وَالْقَمَرُ وَالنُّجُومُ وَالْجِبَالُ وَالشَّجَرُ وَالدَّوَٓابُّ) - (ey Məhəmməd)**, bəs baxıb görmürsən ki, həqiqətən, səmalarda və yerdə olan məxluqat, günəş, ay və ulduzlar, dağlar, ağaclar və heyvanların** (hamısı) **Allah-Təalaya səcdə edirlər?** (Bu şeylərin hamısı Allah-Təalanın qüdrətinə tabe olub, Allah-Təala onların haqqında istədiyi tədbiri görər, müdafiə olunma gücləri olmadığından itaətkarlığın ən böyük əlaməti olaraq səcdə etmələri onlara əmr edildi)**.** (وَكَثِيرٌ مِنَ النَّاسِ وَكَثِيرٌ حَقَّ عَلَيْهِ الْعَذَابُ) **- insanların əksəri də** (Allah-Təalaya itaət və ibadəti tərk etdiklərindən) **əzaba layiq olub,** (düçar olacaqlar. Dünyada hər zaman insanların əksəriyyətinin Allah-Təaladan uzaq olduğunu bildirməkdən ötrü ‘‘əksər’’ sözü ayədə təkrar edildi)**.** (وَمَنْ يُهِنِ اللّٰهُ فَمَا لَهُ مِنْ مُكْرِمٍ) **- Allah-Təala kimi** (öz qəbih əməli səbəbinə) **zəlil və rəzil edib** (əzab versə)**, belə şəxsə hörmət və ehtiram edən tapılmaz.** (Allah-Təala öz əzabını ondan dəf edib onu hörmət sahibi edənə qədər bu belə davam edər)**.** (اِنَّ اللّٰهَ يَفْعَلُ مَا يَشَٓاءُ) **- həqiqətən, Allah-Təala istədiyini edər,** (mömini izzətli, kafiri zəlil edər)**.**

**19-20)** (هٰذَانِ خَصْمَانِ اخْتَصَمُوا فِي رَبِّهِمْ) - (ey Məhəmməd)**, bu iki dəstə** (möminlər və kafirlər) **bir-biriləri ilə düşmən olub rəbləri Allah-Təala haqqında mübahisə edirlər.** (Kafirlər Allah-Təalaya şərik qoşub, möminlər bunu rədd edirlər)**.** (فَالَّذِينَ كَفَرُوا قُطِّعَتْ لَهُمْ ثِيَابٌ مِنْ نَارٍ) – (bu iki dəstədən Allaha şərik qoşub) **kafir olanlar üçün** (cəhənnəm) **atəşindən libas biçilib.** (يُصَبُّ مِنْ فَوْقِ رُؤُسِهِمُ الْحَمِيمُ يُصْهَرُ بِهِ مَا فِي بُطُونِهِمْ وَالْجُلُودُ) – (cəhənnəmə daxil olandan sonra isə) **başlarının üstündən qaynar su tökülər.** (O suyun hərarətindən) **qarınlarında olan** (bağırsaqları, ciyərləri) **və dəriləri əriyər.**

**21)** (وَلَهُمْ مَقَامِعُ مِنْ حَدِيدٍ) **- və onlara** (əzab etməkdən ötrü) **dəmirdən qamçılar var.** (Bu səbəbdən ölmək istəyərlər)**.**

**22)** (كُلَّمَا اَرَادُوا اَنْ يَخْرُجُوا مِنْهَا مِنْ غَمٍّ اُعِيدُوا فِيهَا) – (cəhənnəm əhli) **hamısı dərd-qəm səbəbilə oradan** (qurtulub) **çıxmaq istədikdə,** (o qamçılarla onları vu-

وَذُوقُوا عَذَابَ الْحَرِيقِ ﴿٢٢﴾ اِنَّ اللّٰهَ يُدْخِلُ الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ جَنَّاتٍ تَجْرِي مِنْ
تَحْتِهَا الْاَنْهَارُ يُحَلَّوْنَ فِيهَا مِنْ اَسَاوِرَ مِنْ ذَهَبٍ وَلُؤْلُؤًاۜ وَلِبَاسُهُمْ فِيهَا حَرِيرٌ ﴿٢٣﴾ وَهُدُوا اِلَى
الطَّيِّبِ مِنَ الْقَوْلِۚ وَهُدُوا اِلٰى صِرَاطِ الْحَمِيدِ ﴿٢٤﴾ اِنَّ الَّذِينَ كَفَرُوا وَيَصُدُّونَ عَنْ سَبِيلِ اللّٰهِ
وَالْمَسْجِدِ الْحَرَامِ الَّذِي جَعَلْنَاهُ لِلنَّاسِ سَوَٓاءًۨ الْعَاكِفُ فِيهِ وَالْبَادِۜ وَمَنْ يُرِدْ فِيهِ بِاِلْحَادٍ بِظُلْمٍ نُذِقْهُ مِنْ
عَذَابٍ اَلِيمٍ ﴿٢٥﴾ وَاِذْ بَوَّأْنَا لِاِبْرٰهِيمَ مَكَانَ الْبَيْتِ

---

rub cəhənnəmə) **qaytararlar.** (وَذُوقُوا عَذَابَ الْحَرِيقِ) – (və onlara belə deyilər: inkar etdiyiniz bu) **yandırıcı od əzabını dadın.**

**23)** (اِنَّ اللّٰهَ يُدْخِلُ الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ جَنَّاتٍ تَجْرِي مِنْ تَحْتِهَا الْاَنْهَارُ يُحَلَّوْنَ فِيهَا) (مِنْ اَسَاوِرَ مِنْ ذَهَبٍ وَلُؤْلُؤًا) - (Allah-Təala kafir və müşriklərə belə əzab edər). **Həqiqətən, iman edib saleh əməl edənləri** (qəsrlərinin və ağaclarının) **altından çaylar axan** (cənnət) **bağlarına daxil edər, onlar orada qızıldan qolbaqlarla və mirvarilərlə bəzədilər.** (وَلِبَاسُهُمْ فِيهَا حَرِيرٌ) – **oradakı libasları da ipəkdəndir.** (Hz. Peyğəmbər dünyada ipək libas geyinməyi ümmətinə haram etdiyinə görə Allah-Təala cənnətdə onlara ipək libaslar bəxş edər (Müslüm, Libas 31; Əbu Davud, Libas 11; Tirmizi, Salat 95)).

**24)** (وَهُدُوا اِلَى الطَّيِّبِ مِنَ الْقَوْلِ) – (möminlərə Allah-Təala tərəfindən) **hidayət olunub, pakizə söz deməleri ilham olunar.** (Cənnət əhli bu sözü deyər: "Vədini yerinə yetirən Allaha sonsuz şükürlər olsun!") (وَهُدُوا اِلٰى صِرَاطِ الْحَمِيدِ) – (ondan sonra Allah-Təalanın cənnətinə -) **bəyənilmiş yola yönəldilərlər.**

**25)** (اِنَّ الَّذِينَ كَفَرُوا وَيَصُدُّونَ عَنْ سَبِيلِ اللّٰهِ وَالْمَسْجِدِ الْحَرَامِ) - **həqiqətən,** (Məkkəli müşriklər və) **kafirlər** (insanları) **Allah-Təalanın yolundan** (islamdan) **və Məscidül-haramdan döndərib,** (bunu özlərinə adət ediblər). (الَّذِي جَعَلْنَاهُ لِلنَّاسِ سَوَٓاءًۨ الْعَاكِفُ فِيهِ وَالْبَادِ) - **hansı ki biz** (o Məscidül-haramı) **gəlmə və yerli bütün insanlardan ötrü** (eyni ibadətgah və) **bərabər etmişik.** (Müşriklərin möminlərin oraya daxil olmalarına mane olmağa heç bir haqları yoxdur). (وَمَنْ يُرِدْ فِيهِ بِاِلْحَادٍ بِظُلْمٍ نُذِقْهُ مِنْ عَذَابٍ اَلِيمٍ) - **kim** (ədalətdən azıb) **zülm edərək** (insanların Məscidül-harama daxil olmasına mane olmaq) **istəsə,** (qiyamət günü) **ona şiddətli əzabımızdan dadızdırarıq.** (Məkkəli müşriklər insanların islama, müsəlmanların da Məscidül-harama daxil olub ibadət etmələrinə mane olduğundan bu ayə nazil oldu).

**26)** (وَاِذْ بَوَّأْنَا لِاِبْرٰهِيمَ مَكَانَ الْبَيْتِ) - (ey Məhəmməd, yadına sal)**, bir zaman bu evin** (Kəbənin) **yerini İbrahimdən ötrü hazırladıq** (ki, Şamdan oraya gəlib Kəbəni tiksin. Bu ayədə və bundan sonra gələn ayələrdə Hz. İbrahimin Kəbəni tikib insanları həccə dəvət etməsi bəyan edilir. Belə ki, insanlar bilsinlər ki, Kəbə bir şəxsə məxsus olmayıb bütün insanlara məxsusdur. Kəbənin tikilmə

اَنْ لَا تُشْرِكْ بِي شَيْـًٔا وَطَهِّرْ بَيْتِيَ لِلطَّٓائِفِينَ وَالْقَٓائِمِينَ وَالرُّكَّعِ السُّجُودِ ﴿٢٦﴾ وَاَذِّنْ فِي النَّاسِ بِالْحَجِّ يَأْتُوكَ رِجَالًا وَعَلٰى كُلِّ ضَامِرٍ يَأْتِينَ مِنْ كُلِّ فَجٍّ عَمِيقٍۙ ﴿٢٧﴾ لِيَشْهَدُوا مَنَافِعَ لَهُمْ وَيَذْكُرُوا اسْمَ اللّٰهِ فٖي اَيَّامٍ مَعْلُومَاتٍ عَلٰى مَا رَزَقَهُمْ مِنْ بَهٖيمَةِ الْاَنْعَامِۚ فَكُلُوا مِنْهَا وَاَطْعِمُوا الْبَٓائِسَ الْفَقٖيرَۘ ﴿٢٨﴾

---

əhvalatı Bəqərə surəsində nəql edildi. Hz. İbrahim Kəbəni tikəndən sonra Allah-Təala ona xitab edib buyurur:) (اَنْ لَا تُشْرِكْ بِي شَيْـًٔا) – (ey İbrahim, bu Kəbə ibadət evidir, burada təkcə mənə ibadət edib)**, heç bir şeyi mənə şərik qoşma.** (Hz. İbrahim 16 yaşında şirki xalqa qadağan etdi, Kəbəni tikərkən xeyli yaşlı olub, özü də həmişə şirki qadağan etdiyi halda necə ola bilər ki, bu ayə ona xitab edib, şərik qoşmaması əmr edilsin? Bu səbəbdən ayənin xitabı Hz. İbrahimə olmayıb, məqsəd insanları tövhidə dəvət edib, şirki qadağan etməkdir)**.** (وَطَهِّرْ بَيْتِيَ لِلطَّٓائِفِينَ وَالْقَٓائِمِينَ وَالرُّكَّعِ السُّجُودِ) – (ey İbrahim)**, mənim evimi** (Kəbəmi) **təvaf edənlər və** (ayaqda) **ibadət edib, rüku və səcdə edənlərdən ötrü** (bütlərdən və hər cür nəcis şeylərdən) **pak et.**

**27)** (وَاَذِّنْ فِي النَّاسِ بِالْحَجِّ يَأْتُوكَ رِجَالًا وَعَلٰى كُلِّ ضَامِرٍ) **-** (ya İbrahim)**, insanları da həccə çağır, piyada, ya da zəif dəvələrə minib sənin yanına gəlsinlər,** (يَأْتِينَ مِنْ كُلِّ فَجٍّ عَمِيقٍ) **-** (o dəvələr ki,) **hər cür uzaq yollardan** (Kəbənin ziyarətinə) **gəlirlər.**

**28)** (لِيَشْهَدُوا مَنَافِعَ لَهُمْ) **- belə ki,** (Kəbənin ziyarətinə gəlib həcc etməklə onlar üçün olan dünya və axirət) **mənfəətinə şahid* olsunlar.** (وَيَذْكُرُوا اسْمَ اللّٰهِ فٖي اَيَّامٍ مَعْلُومَاتٍ عَلٰى مَا رَزَقَهُمْ مِنْ بَهٖيمَةِ الْاَنْعَامِ) – (Məkkəyə varid olanda "sə`y" təvafından sonra Minaya gedib) **orada məlum olan günlərdə** (Zilhiccənin 11, 12, 13-ü) **onlara ruzi verilən heyvanların üzərində** (onları qurban edərkən) **Allah-Təalanın** (mübarək) **adını yad etsinlər.** (فَكُلُوا مِنْهَا وَاَطْعِمُوا الْبَٓائِسَ الْفَقٖيرَ) – (ey Minada qurban kəsənlər, o qurbanın ətindən) **yeyin və hər bir yoxsul, fəqir şəxsə də** (onun ətindən) **verin.** (Cahiliyyə ərəbləri qurbanın ətini yeməkdən çəkindiklərinə görə, Allah-Təala Qurani-Şərifdə onu yeyə biləcəklərini bəyan edir)**.**

*(*__Qeyd:__ İslam ümməti həccdə olan dünya mənfəətindən bixəbər olub onun mənfəətini axirətə məxsus edibdir, ondan da bəziləri riyakarlıq, bəziləri də başqa səbəblərə görə, məhrum olub, mallarının xərclənib, özlərini və dəvələrini zəhmətə düçar etməkdən başqa, əllərinə bir şey keçmir. Əgər islam ümməti həccdə olan dünya mənfəətinə - ən əsası da onda olan islamın tərəqqisi qayəsinə agah olsaydılar, hər halda bütün yer kürəsinə yayılıb, onun sahibi olandan sonra belə zəlil və aciz günə düşməzdilər. İslam xəlifələrinin, ya da vəkillərinin həcc əmiri olaraq hər il həccdən ötrü Məkkədə olmaları ən vacib əməllərdən hesab olunurdu və bu işdən zəmanənin şərtlərinə görə siyasi faydalar əldə edib, xilafət və səltənətlərini möhkəmlədərdilər. Bu mətləb Bəqərə surəsində həccin ehkamında təfsilatı ilə zikr olunub, oraya baxılsın).*

ثُمَّ لْيَقْضُوا تَفَثَهُمْ وَلْيُوفُوا نُذُورَهُمْ وَلْيَطَّوَّفُوا بِالْبَيْتِ الْعَتِيقِ ﴿٢٩﴾ ذٰلِكَ وَمَنْ يُعَظِّمْ حُرُمَاتِ اللّٰهِ
فَهُوَ خَيْرٌ لَهُ عِنْدَ رَبِّهِ وَاُحِلَّتْ لَكُمُ الْاَنْعَامُ اِلَّا مَا يُتْلٰى عَلَيْكُمْ فَاجْتَنِبُوا الرِّجْسَ مِنَ الْاَوْثَانِ وَاجْتَنِبُوا
قَوْلَ الزُّورِ ﴿٣٠﴾ حُنَفَاۤءَ لِلّٰهِ غَيْرَ مُشْرِكِينَ بِهِ وَمَنْ يُشْرِكْ بِاللّٰهِ فَكَاَنَّمَا خَرَّ مِنَ السَّمَاۤءِ فَتَخْطَفُهُ الطَّيْرُ
اَوْ تَهْوِي بِهِ الرِّيحُ فِي مَكَانٍ سَحِيقٍ ﴿٣١﴾

---

**29)** (ثُمَّ لْيَقْضُوا تَفَثَهُمْ وَلْيُوفُوا نُذُورَهُمْ) – (Minada qurbanı kəsəndən) **sonra kirlərini təmizləyib** (başlarını, qoltuqaltı və ədəb yerlərinin tüklərini qırxıb, dırnaqlarını kəsib)**,** (varsa) **nəzirlərini versinlər.** (وَلْيَطَّوَّفُوا بِالْبَيْتِ الْعَتِيقِ) – (sonra Hz. İbrahimin tikdiyi) **qədim evi** (Kəbəni) **təvaf etsinlər.** (Qurban kəsəndən sonra edilən bu təvaf həccin təvafıdır)**.**

**30)** (ذٰلِكَ وَمَنْ يُعَظِّمْ حُرُمَاتِ اللّٰهِ فَهُوَ خَيْرٌ لَهُ عِنْدَ رَبِّهِ) – (əvvəldə zikr olunan və əməl edilməsi vacib olan hökmlər) **budur, kim Allah-Təalanın əziz və hörmətli saydığını böyük sayıb** (hörmət etsə)**, əlbəttə, rəbbi Allah-Təala yanında bu onun üçün daha xeyirli** (mənfəətli) **olar.** (وَاُحِلَّتْ لَكُمُ الْاَنْعَامُ اِلَّا مَا يُتْلٰى عَلَيْكُمْ) – (Maidə surəsinin 4-cü ayəsində) **sizə oxunub deyiləndən başqa qalan heyvanlar** (dəvə, öküz, qoyun, keçi əti) **sizə halal olubdur,** (فَاجْتَنِبُوا الرِّجْسَ مِنَ الْاَوْثَانِ) **- xəbis və nəcis bütlərə** (ibadətdən) **çəkinin,** (وَاجْتَنِبُوا قَوْلَ الزُّورِ) – **yalan* sözlərdən** (və yalandan şəhadət etməkdən) **çəkinib** (Allah-Təalanın əzabından qorxun)**.**

*(*Qeyd: Uca peyğəmbər bir gün sübh namazını qılıb bitirəndən sonra ayağa durub camaata dedi: "Ey camaat, yalandan şəhadət etmək Allah-Təalaya şərik qoşmaq qədər günahdır." (Tirmizi, Şəhadət 3; Əbu Davud, Əqdiyə 15) Bu kəlamı 3 dəfə dedi. Amma müsəlmanların arasında cəhalət yayıldığından bu onlar arasında adət olubdur. Nə Allah-Təalanın kitabına, nə də Hz. Peyğəmbərin sözünə qulaq asmayıb, Allah-Təalanın hökmünü az bir məbləğə satıb özlərini və islamı başqa millətlərin nəzərində zəlil və xar edirlər. Onlar da belə zənn edir ki, yalandan şəhadət etmək islamın özündəndir. İnsaf əhli bu ayəyə və bunun kimi ayələrə baxıb islama tənə etməsinlər).*

**31)** (حُنَفَاۤءَ لِلّٰهِ غَيْرَ مُشْرِكِينَ بِهِ) – (batil dinlərdən) **Allah-Təalaya meyil edib hənif olun və Ona şərik qoşmayın.** (وَمَنْ يُشْرِكْ بِاللّٰهِ فَكَاَنَّمَا خَرَّ مِنَ السَّمَاۤءِ) **- kim Allah-Təalaya şərik qoşsa, səmadan** (yerə) **düşən şəxs kimidir,** (فَتَخْطَفُهُ الطَّيْرُ) – (sanki, həlak olub, bədənini) **quşlar parça-parça edib dağıdıbdır.** (اَوْ تَهْوِي بِهِ الرِّيحُ فِي مَكَانٍ سَحِيقٍ) **- ya da** (səmadan düşəndə) **külək onu götürüb uzaq bir məkana atıb** (həlak edibdir. Allah-Təalaya şərik qoşan, haqdan kənar olan şəxsin halı səmadan yıxılıb quşlar tərəfindən parçalanan və ya küləyin dağlara çırpıb həlak etdiyi şəxsə oxşayır. Bu şəxsin sağ qalması nə qədər ümidsizsə, habelə Allah-Təalaya şərik qoşan şəxs də Allah-Təalanın rəhmətindən o qədər kənar və məyus olacaqdır)**.**

ذٰلِكَ وَمَنْ يُعَظِّمْ شَعَآئِرَ اللّٰهِ فَاِنَّهَا مِنْ تَقْوَى الْقُلُوبِ ﴿٣٢﴾ لَكُمْ فِيهَا مَنَافِعُ اِلٰٓى اَجَلٍ مُسَمًّى ثُمَّ مَحِلُّهَآ اِلَى الْبَيْتِ الْعَتِيقِ ﴿٣٣﴾ وَلِكُلِّ اُمَّةٍ جَعَلْنَا مَنْسَكًا لِيَذْكُرُوا اسْمَ اللّٰهِ عَلٰى مَا رَزَقَهُمْ مِنْ بَهِيمَةِ الْاَنْعَامِ

---

**32)** (ذٰلِكَ وَمَنْ يُعَظِّمْ شَعَآئِرَ اللّٰهِ فَاِنَّهَا مِنْ تَقْوَى الْقُلُوبِ) – (zikr olunan və əməl edilməsi vacib olan hökmlər) **budur, kim Allah-Təalanın** (həcdə əmr etdiyi ibadətlərini və) **hökmlərini böyük hesab edib (hörmət etsə), həqiqətən, bu** (müttəqi) **qəlblərin təqvalı** (əməlindəndir. Təqva sahibləri, gərək, Allah-Təalanın hər bir hökmünə təzim və hörmət etsinlər)**.**

**33)** (لَكُمْ فِيهَا مَنَافِعُ اِلٰى اَجَلٍ مُسَمًّى) – (Allah-Təalanın sizin üçün Məkkədə təyin etdiyi ibadət yerlərində) **müəyyən bir vaxta kimi** (böyük*) **dünya** (və axirət) **mənfəəti var,**

*(*Qeyd: Heyif! biz müsəlmanlar o mübarək yerlərdə olan dünya və axirət faydalarının heç birini anlamayıb Məkkəyə yük daşıyan zəlil dəvələr kimi gedib gəlirik. Bəs müsəlmanlar heç diqqət etmirlər ki, Hz. Peyğəmbər ən böyük hökmlərini həcc zamanı Mədinədən Məkkəyə göndərib elan edibdir, ya da özü həcdə olanda bildiribdir. Əvvəlki əsrlərdə böyük hökmdarlar həcc vaxtı Məkkəyə gedib orada məsləhətləşdikləri üçün hökumətləri də möhkəm olurdu. Həcdə Məkkədə toplanmanın ilk faydası budur ki, böyük müsəlman hökmdarlarının ya özləri, ya da elçiləri islamın birliyi məqsədilə, gərək, orada olsunlar. Hökmdarlar bu mətləbdən qafil olduqda, digər insanların orada toplanması ilə şəriət sahibinin nəzərdə tutduğu faydaların hamısı əldə edilməz. Necə ki daha əvvəl də zikr olundu. Xəlifələrin özləri getməyəndə Məkkəyə həcc əmiri təyin edib göndərmələrindəki məqsəd də bu idi. Hətta III xəlifə Osman ibn Əffan həyatından ümidsiz bir halda mühasirədə olarkən ibn Abbası həcc əmiri təyin edib Məkkəyə göndərmişdi. Xilafət qaldırıldığından bəri bu işlər də hamısı aradan götürülüb, xalq o faydaları unudub getdi. O gündən bəri islam fəlakət və zəifliyə düçar olub günbəgün zəif və xəstə düşdü. Necə ki bugünkü gündə islam ümmətində müşahidə olunur).*

(gərək o ibadət yerlərində müəyyən bir vaxta kimi - həcc günləri bir yerə toplanasınız və bu ibadət yerlərinin hamısında, gərək, ehramda olasınız)**.** (ثُمَّ مَحِلُّهَا اِلَى الْبَيْتِ الْعَتِيقِ) – (Mina, Ərəfat, Məş`ərül-həram kimi yerlərdən ayrılandan sonra axır) **gedəcəyiniz yer qədim ev** (Kəbədir, orada ehramdan çıxıb, vida təvafi edib vətənlərinizə qayıdarsınız)**.**

**34)** (وَلِكُلِّ اُمَّةٍ جَعَلْنَا مَنْسَكًا لِيَذْكُرُوا اسْمَ اللّٰهِ عَلٰى مَا رَزَقَهُمْ مِنْ بَهِيمَةِ الْاَنْعَامِ) – (sizdən əvvəlki) **hər bir ümmət üçün** (Allah-Təalaya yaxınlaşmaq üçün) **qurban kəsməyi əmr etdik. Belə ki, Allah-Təalanın onlara ruzi verdiyi qurbanlıq heyvanların** (dəvə, öküz, qoyun, keçinin) **üstündə** (kəsərkən) **Allah-Təalanın adını zikr etsinlər.** (Qurban kəsilən heyvan, gərək, "ənam" adlanan

فَاِلٰهُكُمْ اِلٰهٌ وَاحِدٌ فَلَهُ اَسْلِمُواۜ وَبَشِّرِ الْمُخْبِتِينَۙ ﴿٣٤﴾ اَلَّذِينَ اِذَا ذُكِرَ اللّٰهُ وَجِلَتْ قُلُوبُهُمْ وَالصَّابِرِينَ
عَلٰى مَٓا اَصَابَهُمْ وَالْمُقِيمِي الصَّلٰوةِۙ وَمِمَّا رَزَقْنَاهُمْ يُنْفِقُونَ ﴿٣٥﴾ وَالْبُدْنَ جَعَلْنَاهَا لَكُمْ مِنْ شَعَٓائِرِ
اللّٰهِ لَكُمْ فِيهَا خَيْرٌۗ فَاذْكُرُوا اسْمَ اللّٰهِ عَلَيْهَا صَوَٓافَّۚ فَاِذَا وَجَبَتْ جُنُوبُهَا فَكُلُوا مِنْهَا وَاَطْعِمُوا الْقَانِعَ
وَالْمُعْتَرَّۜ

---

bu 4 heyvandan biri olsun. Bu 4 heyvandan başqasını qurban etmək caiz deyil). (فَاِلٰهُكُمْ اِلٰهٌ وَاحِدٌ) - **sizin məbudunuz tək bir məbud olan Allah-Təaladır.** (فَلَهٓ اَسْلِمُواۜ وَبَشِّرِ الْمُخْبِتِينَ) – **təkcə Allah-Təalaya itaət edib** (ancaq Onu zikr edin. Ey Məhəmməd**, Allah-Təaladan qorxub** (təvazökar olanlara doğru yolda olduqları) **müjdəsini ver.**

**35)** (اَلَّذِينَ اِذَا ذُكِرَ اللّٰهُ وَجِلَتْ قُلُوبُهُمْ) – (Allah-Təalaya qarşı təvazökar olanlar) **elə şəxslərdir ki, yanlarında Allah-Təalanın adı zikr olunduqda, qəlblərində** (Allah qorxusu) **peyda olub,** (əlaməti üzlərində zahir olar). (وَالصَّابِرِينَ عَلٰى مَٓا اَصَابَهُمْ) – (özlərinə, övladlarına, ya da mallarına) **dəyən bəla və müsibətə səbir edərlər.** (وَالْمُقِيمِي الصَّلٰوةِ) – (həmişə) **namazı vaxtında qılarlar.** (وَمِمَّا رَزَقْنَاهُمْ يُنْفِقُونَ) - **və onlara verdiyimiz nemətlərdən** (bizim yolumuzda) **ehsan edərlər.**

**36)** (وَالْبُدْنَ جَعَلْنَاهَا لَكُمْ مِنْ شَعَٓائِرِ اللّٰهِ) – **biz** (Məkkədə) **qurban kəsilən dəvələri* sizdən ötrü** (dinimizin) **əlamətlərindən etdik.**

*(*Qeyd: Ayədə əmr edilən dəvənin kəsilməyi o yerdə lazımdır ki, onun kəsilməsində bu faydalar olsun: möhtac şəxslər orada olsun ki, dəvənin ətindən onlara verilsin. Amma bizim bu dövrdə bu faydanı nəzərə almadıqlarından nəinki dəvənin, heç öküzün, birdən artıq qoyunun və keçinin kəsilməsi də caiz deyildir. Heyvanların məhvinə və israfına səbəbdir. Bu isə haramdır. Qurban kəsmək həccin fərzlərindən olduğuna görə, bir qoyun, ya da keçi kəsmək kifayət edər).*

(لَكُمْ فِيهَا خَيْرٌ) – (dəvənin qurban kəsilməsində) **sizin üçün** (dünya və axirət) **xeyri vardır.** (Dəvənin əti çox olduğundan onu camaata paylayan şəxs həm dünyada ehtiram sahibi olar, həm də axirətdə əcr sahibi olar). (فَاذْكُرُوا اسْمَ اللّٰهِ عَلَيْهَا صَوَٓافَّ) – (dəvələri üzü qibləyə düzüb kəsərkən) **ayaqüstə olduqları halda Allah-Təalanın adını zikr edib,** (sonra kəsin, dəvənin kəsilmə qaydası belədir, dəvə üzü qibləyə, bir əli yuxarı bağlanmış, bir əli iki ayağı üstündə saxlanıb kəsilər. Dəvə, ya da sair heyvanları kəsərkən bu zikri demək yaxşıdır: Allahu Əkbər. la ilahə illallah. Vallahu Əkbər. Allahummə minkə və ileykə - Allah böyükdür. Allahdan başqa məbud yoxdur. Allah böyükdür. Allahım, bunu səndən yenə sənə veririk (Kuleyni, Kafi (Furu), I/302; Tusi, Təhzib, V/221)). (فَاِذَا وَجَبَتْ جُنُوبُهَا فَكُلُوا مِنْهَا) – (dəvələr kəsildikdən sonra) **böyrü üstə yıxılıb** (öldüklərində)**, özünüz də onun** (ətindən) **yeyin.** (Bu ayəyə görə, qurbanın ətindən yemək vacib olmasa da, lazımdır). (وَاَطْعِمُوا الْقَانِعَ وَالْمُعْتَرَّ) – (o dəvənin ətindən)

كَذٰلِكَ سَخَّرْنَاهَا لَكُمْ لَعَلَّكُمْ تَشْكُرُونَ ﴿٣٦﴾ لَنْ يَنَالَ اللّٰهَ لُحُومُهَا وَلَا دِمَآؤُهَا وَلٰكِنْ يَنَالُهُ التَّقْوٰى
مِنْكُمْۜ كَذٰلِكَ سَخَّرَهَا لَكُمْ لِتُكَبِّرُوا اللّٰهَ عَلٰى مَا هَدٰيكُمْۜ وَبَشِّرِ الْمُحْسِنِينَ ﴿٣٧﴾ اِنَّ اللّٰهَ يُدَافِعُ عَنِ
الَّذِينَ اٰمَنُواۜ اِنَّ اللّٰهَ لَا يُحِبُّ كُلَّ خَوَّانٍ كَفُورٍ ﴿٣٨﴾ اُذِنَ لِلَّذِينَ يُقَاتَلُونَ بِاَنَّهُمْ ظُلِمُواۜ وَاِنَّ اللّٰهَ عَلٰى
نَصْرِهِمْ لَقَدِيرٌ ﴿٣٩﴾ اَلَّذِينَ اُخْرِجُوا مِنْ دِيَارِهِمْ بِغَيْرِ حَقٍّ اِلَّا اَنْ يَقُولُوا رَبُّنَا اللّٰهُ

---

**istəyənə də, istəməyənə də verin,** (ola bilər ki, istəməyən istəyəndən daha yoxsul olsun)**.** (كَذٰلِكَ سَخَّرْنَاهَا لَكُمْ لَعَلَّكُمْ تَشْكُرُونَ) – **biz** (Allah-Təala) **onları sizə ram etdik ki,** (Allah-Təalanın nemətlərinə) **şükür edəsiniz.** (Əgər Allah-Təala o dəvələri sizə ram etməsəydi, hər halda buna sizin gücünüz çatmazdı)**.**

**37)** (لَنْ يَنَالَ اللّٰهَ لُحُومُهَا وَلَا دِمَاؤُهَا وَلٰكِنْ يَنَالُهُ التَّقْوٰى مِنْكُمْ) **- o** (qurbanların) **nə əti, nə də qanı Allaha çatmaz. Lakin Allah-Təalaya çatan sizin** (niyyət və əməlinizdə Allah-Təalaya qarşı) **təqvalı olmanızdır.** (كَذٰلِكَ سَخَّرَهَا لَكُمْ لِتُكَبِّرُوا اللّٰهَ عَلٰى مَا هَدٰيكُمْ) **- habelə** (Allah-Təala qurbanlıq heyvanları) **sizə ram etdi ki,** (onları kəsib həcc etdirdiyinə görə) **Allah-Təalaya təzim edib** (bu sözləri deyəsiniz: "Allah uludur, bizi hidayət etdirdiyinə və yardım etdiyinə görə, Allaha şükür və abidlərə müjdə olsun!" Ey Məhəmməd, xeyir əməl sahiblərinə müjdə verib onları bizim rəhmətimizə ümidvar et)**.** (وَبَشِّرِ الْمُحْسِنِينَ) **Ey Məhəmməd! Xeyir əməl sahiblərini bizim rəhmətimizə ümidvar olmaları üçün müjdələ.**

**38)** (اِنَّ اللّٰهَ يُدَافِعُ عَنِ الَّذِينَ اٰمَنُوا) **- həqiqətən, Allah-Təala möminlərdən** (müşrikləri) **dəf edib** (onlara kömək olar)**.** (اِنَّ اللّٰهَ لَا يُحِبُّ كُلَّ خَوَّانٍ كَفُورٍ) **- və həqiqətən, Allah-Təala heç bir xain, nankor şəxsi sevməz.**

**39)** (اُذِنَ لِلَّذِينَ يُقَاتَلُونَ بِاَنَّهُمْ ظُلِمُوا) **-** (bu ayə cihad barəsində nazil olan ilk ayədir, Hz. Peyğəmbər Məkkədə olanda müşriklər səhabələrə xeyli əziyyətlər edib, onlar da gedib peyğəmbərə şikayət edirdilər. O cənab onlara səbir və dözümü əmr etdi. Belə ki, bu ayə cihad barəsində nazil oldu, amma hələ Məkkədə olduqlarından cihad etmələri mümkün olmadı. Bir müddət sonra Mədinəyə hicrət etdiklərində cihad əmri verildi. Ayənin mənası belədir:) **əziyyətə məruz qaldıqlarına görə vuruşan** (möminlərə müşriklərlə cihad etməyə) **izin verildi,** (وَاِنَّ اللّٰهَ عَلٰى نَصْرِهِمْ لَقَدِيرٌ) **- həqiqətən, Allah-Təala** (möminlərə) **kömək etməyə qadirdir.** (Bu ayədə Allah-Təala möminlərə cihad işində kömək etməyi vəd edir)**.**

**40)** (اَلَّذِينَ اُخْرِجُوا مِنْ دِيَارِهِمْ بِغَيْرِ حَقٍّ اِلَّا اَنْ يَقُولُوا رَبُّنَا اللّٰهُ) **–** (o möminlər ki,) **rəbbimiz** (haqq məbud olan) **Allah-Təaladır dediklərinə görə** (müşriklər tərəfindən Məkkədən) **yurdlarından qovulmuşdu,** (onlar da hicrət edib Həbəşistana getdilər, onların qovulmasında heç bir günahları yoxdur. Ancaq tövhidə görə qovuldular, halbuki müvəhhidlərə, gərək, ehtiram olunsun. Bu müşriklər nə qədər xəbis camaatdırlar. Onların bu əməllərinin səbəbinə müsəlmanları

**وَلَوْلَا دَفْعُ اللّٰهِ النَّاسَ بَعْضَهُمْ بِبَعْضٍ لَهُدِّمَتْ صَوَامِعُ وَبِيَعٌ وَصَلَوَاتٌ وَمَسَاجِدُ يُذْكَرُ فِيهَا اسْمُ**
**اللّٰهِ كَثِيرًاؕ وَلَيَنْصُرَنَّ اللّٰهُ مَنْ يَنْصُرُهُؕ اِنَّ اللّٰهَ لَقَوِيٌّ عَزِيزٌ ﴿٤٠﴾ اَلَّذِينَ اِنْ مَكَّنَّاهُمْ فِي الْاَرْضِ اَقَامُوا**
**الصَّلٰوةَ وَاٰتَوُا الزَّكٰوةَ وَاَمَرُوا بِالْمَعْرُوفِ وَنَهَوْا عَنِ الْمُنْكَرِؕ وَلِلّٰهِ عَاقِبَةُ الْاُمُورِ ﴿٤١﴾ وَاِنْ يُكَذِّبُوكَ**
**فَقَدْ كَذَّبَتْ قَبْلَهُمْ قَوْمُ نُوحٍ وَعَادٌ وَثَمُودُۙ ﴿٤٢﴾ وَقَوْمُ اِبْرٰهِيمَ وَقَوْمُ لُوطٍۙ ﴿٤٣﴾ وَاَصْحَابُ مَدْيَنَۚ**
**وَكُذِّبَ مُوسٰى فَاَمْلَيْتُ لِلْكَافِرِينَ ثُمَّ اَخَذْتُهُمْۚ فَكَيْفَ كَانَ نَكِيرِ ﴿٤٤﴾**

---

onlara hakim edib hamısını zəlil və xar edəcəyəm). (وَلَوْلَا دَفْعُ اللّٰهِ النَّاسَ بَعْضَهُمْ بِبَعْضٍ) - **əgər Allah-Təala insanlardan bəzisini** (müşrikləri) **digərləri ilə** (müvəhhidlərlə) **dəf etməsəydi,** (yer üzündə heç bir ibadətxana qalmazdı), (لَهُدِّمَتْ صَوَامِعُ) - **əlbəttə, dağılıb** (xarab olardı) **monastırlar,** (وَبِيَعٌ) - **kilsələr,** (وَصَلَوَاتٌ) – **sinaqoqlar,** (وَمَسَاجِدُ يُذْكَرُ فِيهَا اسْمُ اللّٰهِ كَثِيرًا) - **və Allah-Təalanın adı çox zikr olunan məscidlər,** (bunların hamısını dağıdardılar), (وَلَيَنْصُرَنَّ اللّٰهُ مَنْ يَنْصُرُهُ) - **kim Allah-Təalanın** (dininə və peyğəmbərinə) **kömək etsə, Allah-Təala da ona kömək edər.** (اِنَّ اللّٰهَ لَقَوِيٌّ عَزِيزٌ) - **həqiqətən, Allah-Təala** (dostlarına kömək etməkdə) **qüvvətli və** (düşmənlərindən intiqam almaqda) **qüdrətlidir.**

**41)** (اَلَّذِينَ اِنْ مَكَّنَّاهُمْ فِي الْاَرْضِ اَقَامُوا الصَّلٰوةَ وَاٰتَوُا الزَّكٰوةَ وَاَمَرُوا بِالْمَعْرُوفِ وَنَهَوْا عَنِ الْمُنْكَرِ) - (bu ayədə Allah-Təala mühacirlərin hicrətdən əvvəlki fəzilətlərini bəyan edir: ey Məhəmməd, möminlər) **o şəxslərdir ki,** (hicrət edib Mədinəyə gedəndə biz onlara qüvvət verib) **yer üzündə onları hakim etsək, əlbəttə, Allah-Təalanın əmrinə itaət edib, namaz qılıb zəkat verib, xeyri əmr edib, şəri qadağan edərlər.** (وَلِلّٰهِ عَاقِبَةُ الْاُمُورِ) - **hər bir işin sonu** (aqibəti) **Allah-Təalayadır.** (Allah-Təala vədinə vəfa edib, möminləri müşriklərə qalib edər)**.**

**42-43-44)** (وَاِنْ يُكَذِّبُوكَ فَقَدْ كَذَّبَتْ قَبْلَهُمْ قَوْمُ نُوحٍ وَعَادٌ وَثَمُودُ وَقَوْمُ اِبْرٰهِيمَ وَقَوْمُ لُوطٍ وَاَصْحَابُ مَدْيَنَ) - (müşriklər Hz. Peyğəmbəri təkzib etdikləri üçün Allah-Təala bu ayədə ona təsəlli verir: ey Məhəmməd)**, əgər** (bu müşriklər) **səni təkzib edirlərsə,** (qəmgin olma)**, həqiqətən,** (bu müşriklərdən) **əvvəlki peyğəmbərlərin qövmləri də onları təkzib etdilər,** (onlara baxıb təsəlli tap)**.** (وَكُذِّبَ مُوسٰى) – (hamısından artıq möcüzələri olan) **Musanı da təkzib etdilər.** (İlk təkzib olunan sən deyilsən. Hər bir peyğəmbərin ümməti o peyğəmbəri təkzib edib)**.** (فَاَمْلَيْتُ لِلْكَافِرِينَ ثُمَّ اَخَذْتُهُمْ) - (ey Məhəmməd, peyğəmbərləri təkzib edən) **kafirlərə möhlət verib** (əzablarını təxirə saldım. Onlar da aldanıb xatircəm oldular, ondan sonra qəfildən onları) **yaxalayıb** (əzab göndərib həlak etdim)**.** (فَكَيْفَ كَانَ نَكِيرِ) – (ey Məhəmməd)**, onların** (əməllərini) **inkar edib** (nemətlərini əzaba, həyatlarını matəmə çevirib həlak etməyim) **necə oldu?** (O əzabı özlərindən dəf edə bildilərmi? Səni təkzib edib, mənim də tövhidimi inkar edən Qüreyşin əhvalı belə olacaqdır)**.**

**فَكَاَيِّنْ مِنْ قَرْيَةٍ اَهْلَكْنَاهَا وَهِيَ ظَالِمَةٌ فَهِيَ خَاوِيَةٌ عَلٰى عُرُوشِهَا وَبِئْرٍ مُعَطَّلَةٍ وَقَصْرٍ مَشِيدٍ ﴿٤٥﴾ اَفَلَمْ يَسِيرُوا فِي الْاَرْضِ فَتَكُونَ لَهُمْ قُلُوبٌ يَعْقِلُونَ بِهَٓا اَوْ اٰذَانٌ يَسْمَعُونَ بِهَاۚ فَاِنَّهَا لَا تَعْمَى الْاَبْصَارُ وَلٰكِنْ تَعْمَى الْقُلُوبُ الَّتِي فِي الصُّدُورِ ﴿٤٦﴾ وَيَسْتَعْجِلُونَكَ بِالْعَذَابِ وَلَنْ يُخْلِفَ اللّٰهُ وَعْدَهُۜ وَاِنَّ يَوْمًا عِنْدَ رَبِّكَ كَاَلْفِ سَنَةٍ مِمَّا تَعُدُّونَ ﴿٤٧﴾ وَكَاَيِّنْ مِنْ قَرْيَةٍ اَمْلَيْتُ لَهَا وَهِيَ ظَالِمَةٌ ثُمَّ اَخَذْتُهَاۚ وَاِلَيَّ الْمَصِيرُ ﴿٤٨﴾**

---

**45)** (فَكَاَيِّنْ مِنْ قَرْيَةٍ اَهْلَكْنَاهَا وَهِيَ ظَالِمَةٌ) - (ey Məhəmməd), **zalım olan neçə-neçə məmləkət** (əhlinə əzab göndərib) **həlak etdik.** (فَهِيَ خَاوِيَةٌ عَلٰى عُرُوشِهَا) – (o məmləkətlərin) **damları divarları üstə çöküb** (xarab oldu). (وَبِئْرٍ مُعَطَّلَةٍ وَقَصْرٍ مَشِيدٍ) – **neçə-neçə** (su içilən) **quyular və** (içində zövq alınan) **neçə-neçə möhkəm qəsrlər boş qaldı.**

**46)** (اَفَلَمْ يَسِيرُوا فِي الْاَرْضِ فَتَكُونَ لَهُمْ قُلُوبٌ يَعْقِلُونَ بِهَا) – **bəs** (bu Məkkəli müşriklər) **yer üzündə səfər edib dolaşmırlar ki,** (onlardan əvvəl həlak olanların məkanlarına baxıb Allah-Təalanın tövhidini) **dərk edən qəlbləri, ya da eşidən qulaqları olsun?** (Belə ki, ibrət alıb Allah-Təalaya şərik qoşmasınlar, halbuki səfərə çıxdıqlarında həlak olanların izlərini görürlər. Amma ibrət alan qəlb və qulaqları yoxdur). (اَوْ اٰذَانٌ يَسْمَعُونَ بِهَا فَاِنَّهَا لَا تَعْمَى الْاَبْصَارُ وَلٰكِنْ تَعْمَى الْقُلُوبُ الَّتِي فِي الصُّدُورِ) - **həqiqətən, gözlərin kor olması** (insana bir zərər verməz, əsl zərər verən) **bəlkə, sinələrdəki qəlblərin kor olmasıdır.** (Bu müşriklərin gözləri hərçənd sağlamdır, amma qəlbləri tövhidi dərk etməkdən kor olub küfr və şirk qaranlığında qalıblar).

**47)** (وَيَسْتَعْجِلُونَكَ بِالْعَذَابِ) - (ey Məhəmməd, müşriklər) **səni tələsdirib** (vəd edilən) **əzabın tez gəlməsini istəyirlər,** (belə ki, o əzabı tez gətirəsən). (وَلَنْ يُخْلِفَ اللّٰهُ وَعْدَهُ) – (onlar elə zənn edir ki, Allah-Təala vədinə xilaf çıxıb onlara əzab göndərməyəcəkdir). **Əlbəttə, Allah-Təala vədinə xilaf çıxmayıb,** (vaxtı gələndə Bədir günündə onlara əzab göndərəcəkdir). (وَاِنَّ يَوْمًا عِنْدَ رَبِّكَ كَاَلْفِ سَنَةٍ مِمَّا تَعُدُّونَ) – (sizə görə uzun olan zaman Allah-Təala yanında qısadır. Ey Məhəmməd), **həqiqətən, sənin rəbbin Allah-Təalanın yanında qısa olan bir günün miqdarı sizin saydığınızdan 1000 il kimidir.** (O səbəbdən müşriklərə əzab göndərməkdə tələsmir).

**48)** (وَكَاَيِّنْ مِنْ قَرْيَةٍ اَمْلَيْتُ لَهَا وَهِيَ ظَالِمَةٌ) – (siz Qüreyşlilər kimi) **zalım olduğu halda neçə-neçə məmləkətlərin** (əhlinə) **möhlət verdik.** (Dünya nemətlərimizdən ləzzət alsalar da, nankor oldular). (ثُمَّ اَخَذْتُهَا وَاِلَيَّ الْمَصِيرُ) - **ondan sonra** (qəfildən) **onları yaxalayıb,** (əzab göndərib həlak etdik. Hər kəsin) **axır dönüşü Mənədir.** (Qüdrətimizdən kənar ola bilməzlər).

قُلْ يَآ اَيُّهَا النَّاسُ اِنَّمَآ اَنَا لَكُمْ نَذِيرٌ مُبِينٌۚ ﴿٤٩﴾ فَالَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ لَهُمْ مَغْفِرَةٌ وَرِزْقٌ
كَرِيمٌ ﴿٥٠﴾ وَالَّذِينَ سَعَوْا فِي اٰيَاتِنَا مُعَاجِزِينَ اُولٰٓئِكَ اَصْحَابُ الْجَحِيمِ ﴿٥١﴾ وَمَآ اَرْسَلْنَا مِنْ
قَبْلِكَ مِنْ رَسُولٍ وَلَا نَبِيٍّ اِلَّآ اِذَا تَمَنّٰٓى اَلْقَى الشَّيْطَانُ فِي اُمْنِيَّتِهِۚ

---

**49)** (قُلْ يَٓا اَيُّهَا النَّاسُ اِنَّمَا اَنَا لَكُمْ نَذِيرٌ مُبِينٌ) - (ey Məhəmməd, insanlara) **de ki, həqiqətən, mən sizə** (Allah-Təala tərəfindən) **açıq-aşkar qorxudan** (göndərilmişəm. Allah-Təalanın əzabından qorxub ona şərik qoşmayın)**.**

**50)** (فَالَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ لَهُمْ مَغْفِرَةٌ وَرِزْقٌ كَرِيمٌ) – **o şəxslər ki,** (Qurana) **iman gətirib yaxşı əməllər edir, onlardan ötrü** (Allah-Təala yanında) **günahlarının bağışlanması və gözəl ruzilər vardır.**

**51)** (وَالَّذِينَ سَعَوْا فِي اٰيَاتِنَا مُعَاجِزِينَ اُولٰٓئِكَ اَصْحَابُ الْجَحِيمِ) – **o** (müşrik) **şəxslər ki, ayələrimizin** (Quranın batil olması üçün) **səy edir ki,** (xalqın Qurana iman etməsinə mane olub) **aciz etsinlər** (Qurana gah şeir, gah sehr dedilər, onlar üçün axirətdə əzab olub) **cəhənnəmlikdirlər,** (heç vaxt oradan xilas ola bilməzlər. Qüreyş camaatı Məkkədə Hz. Peyğəmbərə itaət etməyib ona min bir əziyyət etdikdə, o cənab qəlbən Allah-Təaladan xahiş etdi ki, müşriklərin barəsində bir müddət ona ayə nazil olmasın ki, bəlkə, ona əziyyət etməyib meyil etsinlər. Allah-Təala Hz. Peyğəmbərin bu arzusunu qəbul edib vəhy göndərməyi bir müddət dayandırdı. Bir gün müşriklərlə bir məclisdə idi. Ən-Nəcm surəsi (bu kitabın 3-cü cildində inşallah zikr olunacaq) nazil oldu. Hz. peyğəmbər oxumağa başladı, Qüreyş camaatı da qulaq asırdı, elə ki: - "Gördünüzmü o Lat və Uzzanı? Və üçüncüləri olan o birisini.. Mənatı", -ayəsini eşitdilər, Allah-Təalanın bu bütləri məzəmmət etmək üçün ayə göndərdiyini bildilər, Hz. Peyğəmbər bu ayəni oxuyan kimi onun yanında oturan Qüreyşli şeytanlardan biri belə davam etdi: "Bunlar uca qu quşlarıdır və onların şəfaəti də ümid edilir". Yəni adları çəkilən bu 3 büt gözəl və dəyərli bütlərdir, həqiqətən, onların Allah-Təala dərgahında şəfaət etməsi ümid edilir. Qüreyş camaatı bu sözü eşidən kimi səs salıb şadyanalıq etdilər, camaata da elan etdilər ki, Hz. Peyğəmbər bizim bütlərimizi öz Quranında zikr etdi. Surənin axırında Hz. peyğəmbər səcdə etdi, müşriklər də səcdə etdilər, ancaq iki nəfər Qüreyşli qoca olduqlarından səcdə edə bilməyib, bir qədər torpaq götürüb alınlarına yapışdırdılar. Onlardan biri Vəlid ibn Müğirə, o birisi Səid ibnül-Asdır. Ondan sonra oradan ayrılıb dedilər: "Yaxşı oldu, Məhəmməd bizim bütlərimizi də öz Quranında zikr etdi." Hz. peyğəmbər bu işdən çox qəmgin oldu. O səbəbdən aşağıda qeyd olunan ayə nazil olub, onların sözlərini batil etdi)**.**

**52)** (وَمَٓا اَرْسَلْنَا مِنْ قَبْلِكَ مِنْ رَسُولٍ وَلَا نَبِيٍّ اِلَّٓا اِذَا تَمَنّٰٓى اَلْقَى الشَّيْطَانُ فِي اُمْنِيَّتِهِ) - (ey Məhəmməd)**, səndən əvvəl heç bir peyğəmbər göndərmədik ki, o, bir şey arzu etdikdə** (müşrikləri qeyzə gətirən hökmlər ona nazil olmasın, Allah-

**فَيَنْسَخُ اللّٰهُ مَا يُلْقِي الشَّيْطَانُ ثُمَّ يُحْكِمُ اللّٰهُ اٰيَاتِهٖ وَاللّٰهُ عَلِيمٌ حَكِيمٌ ﴿٥٢﴾ لِيَجْعَلَ مَا يُلْقِي الشَّيْطَانُ فِتْنَةً لِلَّذِينَ فِي قُلُوبِهِمْ مَرَضٌ وَالْقَاسِيَةِ قُلُوبُهُمْ وَاِنَّ الظَّالِمِينَ لَفِي شِقَاقٍ بَعِيدٍ ﴿٥٣﴾ وَلِيَعْلَمَ الَّذِينَ اُوتُوا الْعِلْمَ اَنَّهُ الْحَقُّ مِنْ رَبِّكَ فَيُؤْمِنُوا بِهٖ فَتُخْبِتَ لَهُ قُلُوبُهُمْ وَاِنَّ اللّٰهَ لَهَادِ الَّذِينَ اٰمَنُوٓا اِلٰى صِرَاطٍ مُسْتَقِيمٍ ﴿٥٤﴾ وَلَا يَزَالُ الَّذِينَ كَفَرُوا فِي مِرْيَةٍ مِنْهُ حَتّٰى تَأْتِيَهُمُ السَّاعَةُ بَغْتَةً اَوْ يَأْتِيَهُمْ عَذَابُ يَوْمٍ عَقِيمٍ ﴿٥٥﴾ اَلْمُلْكُ يَوْمَئِذٍ لِلّٰهِ يَحْكُمُ بَيْنَهُمْ**

---

Təala sənin arzunu qəbul edən kimi onların da arzusunu yerinə yetirdi. Belə ki, müşriklərdən) **bir şeytan da** (o peyğəmbərlərin) **diləklərinə xələl saldı.** (Necə ki sən Quran oxuyanda o şeytan bütlər barəsində olan o sözü araya salıb zikr etdi. O kəlam bizim kəlamımız deyil. Müşriklər sənə iftira edirlər, o şeytanın kəlamıdır). (فَيَنْسَخُ اللّٰهُ مَا يُلْقِي الشَّيْطَانُ ثُمَّ يُحْكِمُ اللّٰهُ اٰيَاتِهٖ) **- Allah-Təala şeytanın** (Quranın arasına) **saldığı şeyi** (sözü) **batil edər. Ondan sonra öz ayələrini möhkəmləndirər** (ki, bir də heç vaxt dəyişməsin). (وَاللّٰهُ عَلِيمٌ حَكِيمٌ) **- Allah-Təala** (insanların əhvalına) **agah olub, hikmət üzrə hökm verəndir.**

**53)** (لِيَجْعَلَ مَا يُلْقِي الشَّيْطَانُ فِتْنَةً لِلَّذِينَ فِي قُلُوبِهِمْ مَرَضٌ) - (ey Məhəmməd, Allah-Təala) **şeytanın** (Quranın arasına) **saldığı şeyi qəlblərində** (nifaq, şəkk) **xəstəliyi olan şəxslərdən ötrü imtahan vasitəsi edər.** (Görsün ki, onların nifaq və şəkki daha da artır, yoxsa qayıdıb mömin olurlar). (وَالْقَاسِيَةِ قُلُوبُهُمْ)**- bir də, qəlblərində qatılıq olan** (müşriklərdən) **ötrü** (imtahan vasitəsi edər). (وَاِنَّ الظَّالِمِينَ لَفِي شِقَاقٍ بَعِيدٍ) **- həqiqətən, zalım olan** (münafiq və müşriklər) **haqdan uzaq bir ziddiyyət,** (ayrılıq) **içindədirlər.** (Əsla iman etməzlər).

**54)** (وَلِيَعْلَمَ الَّذِينَ اُوتُوا الْعِلْمَ اَنَّهُ الْحَقُّ مِنْ رَبِّكَ) – (ey Məhəmməd, əlbəttə, elm sahibləri) **bilir ki,** (bu Quran) **haqdır və sənin rəbbin Allah-Təaladandır** (və şeytanın Quranın arasına saldığı sözlər batildir). (فَيُؤْمِنُوا بِهٖ فَتُخْبِتَ لَهُ قُلُوبُهُمْ) – (elm əhli) **Qurana iman edib, qəlbləri ondan arxayın olar,** (başqa sözləri batil bilirlər). (وَاِنَّ اللّٰهَ لَهَادِ الَّذِينَ اٰمَنُوا اِلٰى صِرَاطٍ مُسْتَقِيمٍ) **- həqiqətən, Allah-Təala möminləri düz olan** (Quran) **yoluna hidayət edər,** (belə ki, din ehkamından onlara çətin olan şeyləri ağıla uyğun yozub, mənasız şeyləri tərk edib bir kənara qoysunlar).

**55)** (وَلَا يَزَالُ الَّذِينَ كَفَرُوا فِي مِرْيَةٍ مِنْهُ) **- kafir olan şəxslər isə həmişə** (bu Quran haqqında) **şəkdə olub** (ona iman gətirməyəcəklər). (حَتّٰى تَأْتِيَهُمُ السَّاعَةُ بَغْتَةً اَوْ يَأْتِيَهُمْ عَذَابُ يَوْمٍ عَقِيمٍ) **- belə ki, qəfildən qiyamət onlara gəlsin, ya da** (qiyamətdən əvvəl xeyirsiz) **qısır* bir günün** (Bədir günü) **əzabı gəlib onları yaxalayıb** (zəlil və ya həlak etsin. Necə ki Bədir savaşında bu vəd vaqe oldu).

**56)** (اَلْمُلْكُ يَوْمَئِذٍ لِلّٰهِ يَحْكُمُ بَيْنَهُمْ) – (qiyamət günü) **hakimiyyət Allah-Təalaya məxsusdur.** (Allah-Təala o gün müşriklərlə möminlərin arasında) **hökm edər.**

فَالَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ فِي جَنَّاتِ النَّعِيمِ ﴿٥٦﴾ وَالَّذِينَ كَفَرُوا وَكَذَّبُوا بِاٰيَاتِنَا فَاُولٰٓئِكَ
لَهُمْ عَذَابٌ مُهِينٌ ﴿٥٧﴾ وَالَّذِينَ هَاجَرُوا فِي سَبِيلِ اللّٰهِ ثُمَّ قُتِلُوٓا اَوْ مَاتُوا لَيَرْزُقَنَّهُمُ اللّٰهُ رِزْقًا حَسَنًاۜ
وَاِنَّ اللّٰهَ لَهُوَ خَيْرُ الرَّازِقِينَ ﴿٥٨﴾ لَيُدْخِلَنَّهُمْ مُدْخَلًا يَرْضَوْنَهُۜ وَاِنَّ اللّٰهَ لَعَلِيمٌ حَلِيمٌ ﴿٥٩﴾ ذٰلِكَۚ
وَمَنْ عَاقَبَ بِمِثْلِ مَا عُوقِبَ بِهٖ ثُمَّ بُغِيَ عَلَيْهِ لَيَنْصُرَنَّهُ اللّٰهُۜ اِنَّ اللّٰهَ لَعَفُوٌّ غَفُورٌ ﴿٦٠﴾

---

(Allah-Təalanın hökmü budur:) (فَالَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ فِي جَنَّاتِ النَّعِيمِ) **- o şəxslər ki,** (Allah-Təalaya iman gətirib) **yaxşı və gözəl əməllər edir, onların** (axirətdəki məskənləri) **bol nemətləri olan** (əbədi cənnət) **bağlarındadır,** (heç vaxt oradan çıxmazlar)**.**

**57)** (وَالَّذِينَ كَفَرُوا وَكَذَّبُوا بِاٰيَاتِنَا فَاُولٰٓئِكَ لَهُمْ عَذَابٌ مُهِينٌ) **- o şəxslər ki kafir olub bizim ayələrimizi** (Quranı) **təkzib edir, onlardan ötrü zəlil və xar edən əzab vardır,** (heç vaxt o əzabdan xilas ola bilməzlər)**.**

**58)** (وَالَّذِينَ هَاجَرُوا فِي سَبِيلِ اللّٰهِ ثُمَّ قُتِلُوا اَوْ مَاتُوا) **- o şəxslər ki Allah-Təala yolunda hicrət edib, ondan sonra öldürülüb, ya da ölür,** (لَيَرْزُقَنَّهُمُ اللّٰهُ رِزْقًا حَسَنًا) **- əlbəttə, Allah-Təala** (axirətdə) **o şəxslərə gözəl** (və sonsuz) **ruzi verəcək.** (Allah-Təala öz lütf və mərhəməti ilə onun yolunda hicrət edib ölənləri şəhid olanlarla əcr və savabda eyni sayır)**.** (وَاِنَّ اللّٰهَ لَهُوَ خَيْرُ الرَّازِقِينَ) **- həqiqətən, Allah-Təala ruzi verənlərin ən yaxşısıdır.**

*(*Qeyd: Bədir savaşında müşriklərə heç bir xeyir gəlmədiyindən o gün belə adlandı və xeyirsiz olan, əzab verən hər bir şey də "əqim" – qısır, xeyirsiz adlanır. Necə ki Ad camaatını həlak edən yelə "əqim" yeli deyilir).*

(Məxluqatdan ruzi verən də, aralıqda vasitə olub həqiqi ruzi verən Allah-Təaladır)**.**

**59)** (لَيُدْخِلَنَّهُمْ مُدْخَلًا يَرْضَوْنَهُ) **- əlbəttə, Allah-Təala** (mühacirlərə hörmət edib) **onları razı qalacaqları bir yerə daxil edər.** (وَاِنَّ اللّٰهَ لَعَلِيمٌ حَلِيمٌ) **- həqiqətən, Allah-Təala** (hər kəsdən) **agahdır və həlimdir** (günahkara əzab etməkdə tələsən deyil)**.**

**60)** (ذٰلِكَ) – (hicrət edənlərin hökmü) **budur.** (وَمَنْ عَاقَبَ بِمِثْلِ مَا عُوقِبَ بِهٖ ثُمَّ بُغِيَ عَلَيْهِ) – (möminlərdən) **kim** (müşriklərin ona etdiyi) **əzaba eynilə əvəz versə, ondan sonra yenə** (o möminə) **zülm edilsə,** (لَيَنْصُرَنَّهُ اللّٰهُ اِنَّ اللّٰهَ لَعَفُوٌّ غَفُورٌ)– **şübhəsiz ki, Allah-Təala ona yardım edər. Allah-Təala əfv edib bağışlayandır.** (Allah-Təala Qurani-Şərifdə neçə dəfə məzluma zalımı bağışlamağı əmr edir, amma əgər məzlum ikinci dəfə də bu zülmə səbir etsə, Allah-Təala onun intiqamını zalımdan alar və əgər ikinci dəfə də səbir etməyib özü intiqam alsa, Allah-Təala onu qınamayıb güzəşt edib bağışlayar)**.**

ذٰلِكَ بِاَنَّ اللّٰهَ يُولِجُ الَّيْلَ فِي النَّهَارِ وَيُولِجُ النَّهَارَ فِي الَّيْلِ وَاَنَّ اللّٰهَ سَمٖيعٌ بَصٖيرٌ ﴿٦١﴾ ذٰلِكَ بِاَنَّ اللّٰهَ هُوَ الْحَقُّ وَاَنَّ مَا يَدْعُونَ مِنْ دُونِهٖ هُوَ الْبَاطِلُ وَاَنَّ اللّٰهَ هُوَ الْعَلِيُّ الْكَبٖيرُ ﴿٦٢﴾ اَلَمْ تَرَ اَنَّ اللّٰهَ اَنْزَلَ مِنَ السَّمَٓاءِ مَٓاءًۘ فَتُصْبِحُ الْاَرْضُ مُخْضَرَّةًۜ اِنَّ اللّٰهَ لَطٖيفٌ خَبٖيرٌۚ ﴿٦٣﴾ لَهُ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِۜ وَاِنَّ اللّٰهَ لَهُوَ الْغَنِيُّ الْحَمٖيدُۚ ﴿٦٤﴾ اَلَمْ تَرَ اَنَّ اللّٰهَ سَخَّرَ لَكُمْ مَا فِي الْاَرْضِ وَالْفُلْكَ تَجْرٖي فِي الْبَحْرِ بِاَمْرِهٖۜ وَيُمْسِكُ السَّمَٓاءَ اَنْ تَقَعَ عَلَى الْاَرْضِ اِلَّا بِاِذْنِهٖۜ

---

**61)** (ذٰلِكَ) **– bu** (kömək ona görədir ki, Allah hər bir zalım şəxsdən intiqam almağa qadirdir). (بِاَنَّ اللّٰهَ يُولِجُ الَّيْلَ فِي النَّهَارِ وَيُولِجُ النَّهَارَ فِي الَّيْلِ) **- Allah-Təalanın kamil qüdrətinin əlamətindən biri odur ki, gecəni qısaldıb gündüzə daxil edər və gündüzü gecəyə daxil edər.** (Qədim astronomlara görə günəşin ekvator xəttindən gah şimala, gah da cənuba hərəkət etməsi ilə, ya da yeni astronomlara görə günəşin öz mərkəzində sabit və bərqərar olub yer kürəsinin hərəkət edərək günəşə gah yaxın, gah da uzaq olmasına görə, Allah-Təala öz kamil qüdrəti ilə gecə-gündüzü müxtəlif etdi. Onun qüdrəti nə ulu və müqəddəsdir). (وَاَنَّ اللّٰهَ سَمٖيعٌ بَصٖيرٌ) **- həqiqətən, Allah-Təala** (insanların dediyi və etdiyi hər şeyi) **eşidən və görəndir.**

**62)** (ذٰلِكَ بِاَنَّ اللّٰهَ هُوَ الْحَقُّ) **– bu** (ilahi qüdrətin səbəbi odur ki,) **Allah-Təala həqiqətən haqq** (məbuddur). (Haqq olan yeganə məbudun hər bir şeyə qüdrəti olar, nəinki batil məbudun). (وَاَنَّ مَا يَدْعُونَ مِنْ دُونِهٖ هُوَ الْبَاطِلُ) **- həqiqətən, Allah-Təaladan başqa, dua və ibadət etdikləri hər şey batildir,** (وَاَنَّ اللّٰهَ هُوَ الْعَلِيُّ الْكَبٖيرُ) **- həqiqətən, Allah-Təala** (öz qüdrət və hakimiyyəti ilə hər şeydən) **böyük və ucadır.**

**63)** (اَلَمْ تَرَ اَنَّ اللّٰهَ اَنْزَلَ مِنَ السَّمَٓاءِ مَٓاءً فَتُصْبِحُ الْاَرْضُ مُخْضَرَّةً) - (Allah-Təala bundan sonra gələn ayələrdə öz kamil qüdrətini bəyan edir: ey Məhəmməd)**, bəs baxıb görmürsən ki, həqiqətən, Allah-Təala səmadan su göndərib,** (qupquru, otsuz) **yer** (o su səbəbilə ot-ələfli) **yamyaşıl olur?** (اِنَّ اللّٰهَ لَطٖيفٌ خَبٖيرٌ) **- həqiqətən, Allah-Təala** (insanlara qarşı tədbirli və) **diqqətli və** (əməllərindən) **xəbərdardır.**

**64)** (لَهُ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِ وَاِنَّ اللّٰهَ لَهُوَ الْغَنِيُّ الْحَمٖيدُ) **- səmalarda və yerdə olan hər bir şey Allah-Təalanın mülküdür. Həqiqətən, əlbəttə, Allah-Təala** (məxluqata) **möhtac olmayan və** (hər bir feilində) **bəyənilləndir.**

**65)** (اَلَمْ تَرَ اَنَّ اللّٰهَ سَخَّرَ لَكُمْ مَا فِي الْاَرْضِ) - (ey Məhəmməd)**, bəs baxıb görmürsən ki, həqiqətən, Allah-Təala yerdə olan** (heyvanatı və sair ehtiyacınız olan) **şeyləri sizə ram edib,** (istədiyiniz kimi idarə edirsiniz?) (وَالْفُلْكَ تَجْرٖي فِي الْبَحْرِ بِاَمْرِهٖ) **- dənizdə Onun əmri ilə üzən gəmiləri** (sizə ram edib, o gəmilərlə istədiyiniz yerə gedirsiniz). (وَيُمْسِكُ السَّمَٓاءَ اَنْ تَقَعَ عَلَى الْاَرْضِ اِلَّا بِاِذْنِهٖ) – (Allah-Təala

اِنَّ اللّٰهَ بِالنَّاسِ لَرَؤُفٌ رَحِيمٌ ﴿٦٥﴾ وَهُوَ الَّذِي اَحْيَاكُمْ ثُمَّ يُمِيتُكُمْ ثُمَّ يُحْيِيكُمْ اِنَّ الْاِنْسَانَ لَكَفُورٌ ﴿٦٦﴾ لِكُلِّ اُمَّةٍ جَعَلْنَا مَنْسَكًا هُمْ نَاسِكُوهُ فَلَا يُنَازِعُنَّكَ فِي الْاَمْرِ وَادْعُ اِلٰى رَبِّكَ اِنَّكَ لَعَلٰى هُدًى مُسْتَقِيمٍ ﴿٦٧﴾ وَاِنْ جَادَلُوكَ فَقُلِ اللّٰهُ اَعْلَمُ بِمَا تَعْمَلُونَ ﴿٦٨﴾ اَللّٰهُ يَحْكُمُ بَيْنَكُمْ يَوْمَ الْقِيٰمَةِ فِيمَا كُنْتُمْ فِيهِ تَخْتَلِفُونَ ﴿٦٩﴾ اَلَمْ تَعْلَمْ اَنَّ اللّٰهَ يَعْلَمُ مَا فِي السَّمَاءِ وَالْاَرْضِ اِنَّ ذٰلِكَ فِي كِتَابٍ اِنَّ ذٰلِكَ عَلَى اللّٰهِ يَسِيرٌ ﴿٧٠﴾

---

öz kamil qüdrəti ilə) **Onun izni olmadan səmanı** (və ildırım, meteor kimi qorxunc şeyləri) **yerə düşməkdən saxlayır,** (Belə ki, sizə bir zərər dəyməsin. Mədəni ölkələrin muzeylərində o meteorlardan bəzisi sərgiyə qoyulub)**.** (اِنَّ اللّٰهَ بِالنَّاسِ لَرَؤُفٌ رَحِيمٌ) **- həqiqətən, Allah-Təala** (insanlara qarşı) **mehriban və rəhmlidir.**

**66)** (وَهُوَ الَّذِيٓ اَحْيَاكُمْ ثُمَّ يُمِيتُكُمْ ثُمَّ يُحْيِيكُمْ) **- kamil qüdrəti ilə ki sizi yoxdan yaradan, sonra öldürüb, daha sonra dirildib,** (məhşərə götürən) **o** (qadir) **Allah-Təaladır.** (اِنَّ الْاِنْسَانَ لَكَفُورٌ) **- həqiqətən, insan** (Allah-Təalanın nemətlərinə, ən üstün olan həyat nemətinə) **nankor olandır.**

**67)** (لِكُلِّ اُمَّةٍ جَعَلْنَا مَنْسَكًا هُمْ نَاسِكُوهُ) **-** (ey Məhəmməd, necə ki sizdən ötrü bu din və şəriəti vermişik, habelə sizdən əvvəlki) **hər bir ümmətdən ötrü də bir din və bir şəriət verdik ki, ona** (möhkəm) **əməl etsinlər,** (siz də gərək öz dininizdən möhkəm yapışıb, əməl edib, başqalarının sözlərinə qulaq asmayasınız)**.** (فَلَا يُنَازِعُنَّكَ فِي الْاَمْرِ) **-** (ey Məhəmməd, müşriklərə iltifat və etimad etmə ki,) **onlar da səninlə** (din) **işində mübahisə etməyə** (cürət etməsinlər)**.** (وَادْعُ اِلٰى رَبِّكَ) **- sən** (insanları) **rəbbin Allah-Təalanın** (yoluna) **dəvət et.** (اِنَّكَ لَعَلٰى هُدًى مُسْتَقِيمٍ) **-** (ey Məhəmməd)**, həqiqətən, sən düz** (və möhkəm olan) **hidayət yolundasan.** (Müşriklərin sözlərinə baxmayıb onlardan üz döndər)**.**

**68)** (وَاِنْ جَادَلُوكَ فَقُلِ اللّٰهُ اَعْلَمُ بِمَا تَعْمَلُونَ) **-** (ey Məhəmməd, əgər müşriklər səndən əl çəkməyib) **səninlə mücadilə etsələr,** (onlara) **de ki,** (mənim sizə heç bir sözüm yoxdur)**, sizin** (çirkin) **əməllərinizdən Allah-Təala agahdır,** (özü sizə cəza verəcəkdir)**.**

**69)** (اَللّٰهُ يَحْكُمُ بَيْنَكُمْ يَوْمَ الْقِيٰمَةِ فِيمَا كُنْتُمْ فِيهِ تَخْتَلِفُونَ) **- Allah-Təala qiyamət günündə siz** (möminlərlə kafirlərin) **aranızda ixtilaf etdiyiniz** (islam) **haqqında hökm edəcəkdir.**

**70)** (اَلَمْ تَعْلَمْ اَنَّ اللّٰهَ يَعْلَمُ مَا فِي السَّمَاءِ وَالْاَرْضِ) **-** (ey Məhəmməd)**, bəs sən agah deyilsən ki, həqiqətən, Allah-Təala səmada və yerdə olan hər bir şeydən agahdır?** (Xitab peyğəmbərədir, amma məqsəd bütün insanlıqdır)**.** (اِنَّ ذٰلِكَ فِي كِتَابٍ اِنَّ ذٰلِكَ عَلَى اللّٰهِ يَسِيرٌ) **- həqiqətən, bu** (məlumatlar Allah-Təalanın elmi

وَيَعْبُدُونَ مِنْ دُونِ اللّٰهِ مَا لَمْ يُنَزِّلْ بِه۪ سُلْطَانًا وَمَا لَيْسَ لَهُمْ بِه۪ عِلْمٌۜ وَمَا لِلظَّالِم۪ينَ مِنْ نَص۪يرٍ ﴿٧١﴾
وَاِذَا تُتْلٰى عَلَيْهِمْ اٰيَاتُنَا بَيِّنَاتٍ تَعْرِفُ ف۪ي وُجُوهِ الَّذ۪ينَ كَفَرُوا الْمُنْكَرَۜ يَكَادُونَ يَسْطُونَ بِالَّذ۪ينَ يَتْلُونَ
عَلَيْهِمْ اٰيَاتِنَاۜ قُلْ اَفَاُنَبِّئُكُمْ بِشَرٍّ مِنْ ذٰلِكُمْۜ اَلنَّارُۜ وَعَدَهَا اللّٰهُ الَّذ۪ينَ كَفَرُواۜ وَبِئْسَ الْمَص۪يرُ ﴿٧٢﴾
يَٓا اَيُّهَا النَّاسُ ضُرِبَ مَثَلٌ فَاسْتَمِعُوا لَهُۜ اِنَّ الَّذ۪ينَ تَدْعُونَ مِنْ دُونِ اللّٰهِ لَنْ يَخْلُقُوا ذُبَابًا وَلَوِ اجْتَمَعُوا
لَهُۜ وَاِنْ يَسْلُبْهُمُ الذُّبَابُ شَيْـًٔا لَا يَسْتَنْقِذُوهُ مِنْهُۜ ضَعُفَ الطَّالِبُ وَالْمَطْلُوبُ ﴿٧٣﴾

---

olan Lövhi-məhfuz) **kitabında sabit və bərqərardır, həqiqətən, bu** (elmləri bilmək) **Allah-Təalaya çox asandır.**

**71)** (وَيَعْبُدُونَ مِنْ دُونِ اللّٰهِ مَا لَمْ يُنَزِّلْ بِه۪ سُلْطَانًا) – (müşriklər) **Allah-Təaladan başqa elə** (bütlərə) **ibadət edirlər ki,** (Allah-Təala onlara ibadət etmək haqda) **heç bir dəlil nazil etməyibdir.** (وَمَا لَيْسَ لَهُمْ بِه۪ عِلْمٌ) **- o haqda** (bütlərin haqq olması haqda) **heç bir elmləri yoxdur,** (Belə ki, onlara ibadət etmələri dəlil üzrə olsun)**.** (وَمَا لِلظَّالِم۪ينَ مِنْ نَص۪يرٍ) – (bütə sitayiş edən müşriklər zalımdırlar)**, zalımlara bir kömək edən də olmaz.** (Belə ki, Allah-Təalanın əzabını onlardan dəf etsin)**.**

**72)** (وَاِذَا تُتْلٰى عَلَيْهِمْ اٰيَاتُنَا بَيِّنَاتٍ) **-** (ey Məhəmməd, tövhidə dəlil olan) **açıq-aşkar ayələrimiz** (Quran) **müşriklərə oxunduqda,** (تَعْرِفُ ف۪ي وُجُوهِ الَّذ۪ينَ كَفَرُوا الْمُنْكَرَ) – **kafir olanların üzlərində inkar** (və ikrah) **sezərsən,** (يَكَادُونَ يَسْطُونَ بِالَّذ۪ينَ يَتْلُونَ عَلَيْهِمْ اٰيَاتِنَا) – (müşriklər) **az qalırlar ki, ayələrimizi** (Quranı) **onlara oxuyan şəxslərə hücum edib** (savaşsınlar)**.** (قُلْ اَفَاُنَبِّئُكُمْ بِشَرٍّ مِنْ ذٰلِكُمْ اَلنَّارُ) **-** (ey Məhəmməd, müşriklərə) **de ki, bu** (Qurandan daha çox acığınız gələn) **pis şeyi sizə xəbər verim, o, cəhənnəm odudur,** (Allah-Təala sizdən ötrü hazır edəcək)**.** (وَعَدَهَا اللّٰهُ الَّذ۪ينَ كَفَرُوا وَبِئْسَ الْمَص۪يرُ) **- Allah-Təala cəhənnəm odunu kafir şəxslərə vəd edibdir, o, nə pis qayıdış yeridir,** (heç vaxt oradan xilas ola bilməyəcəklər)**.**

**73)** (يَٓا اَيُّهَا النَّاسُ ضُرِبَ مَثَلٌ فَاسْتَمِعُوا لَهُ) **- ey insanlar,** (yəni ey müşriklər, sizdən ötrü qəribə) **bir məsəl çəkildi, ona qulaq asıb** (düşünün)**.** (اِنَّ الَّذ۪ينَ تَدْعُونَ مِنْ دُونِ اللّٰهِ لَنْ يَخْلُقُوا ذُبَابًا وَلَوِ اجْتَمَعُوا لَهُ) **- həqiqətən, Allah-Təaladan başqa sitayiş etdiyiniz o bütlər bir yerə toplanıb** (bir-birilərinə kömək etsələr də) **bir milçək də yarada bilməzlər,** (halbuki o milçək Allah-Təalanın ən zəif məxluqlarındandır)**.** (وَاِنْ يَسْلُبْهُمُ الذُّبَابُ شَيْـًٔا لَا يَسْتَنْقِذُوهُ مِنْهُ) **- əgər o milçəklər** (o bütlərdən) **bir şey götürüb aparsalar da,** (o bütlərdə güc olmaz ki,) **o şeyi onlardan geri alıb** (xilas etsinlər)**.** (ضَعُفَ الطَّالِبُ وَالْمَطْلُوبُ) – (o şeyi) **istəyən** (bütlər) **və istənən** (milçəklərin hər ikisi) **zəifdir.** (Hətta bütlər cansız olduqlarından milçəklərdən də zəifdirlər. İbn Abbas deyir: "Müşriklər bütlərin başına zəfəran və bal sürtüb qapıları bağladılar, milçəklər bir yol tapıb onların başına oturub balı yedilər")**.**

مَا قَدَرُوا اللّٰهَ حَقَّ قَدْرِهٖۜ اِنَّ اللّٰهَ لَقَوِيٌّ عَز۪يزٌ ﴿٧٤﴾ اَللّٰهُ يَصْطَف۪ي مِنَ الْمَلٰٓئِكَةِ رُسُلًا وَمِنَ النَّاسِۜ اِنَّ اللّٰهَ
سَم۪يعٌ بَص۪يرٌۚ ﴿٧٥﴾ يَعْلَمُ مَا بَيْنَ اَيْد۪يهِمْ وَمَا خَلْفَهُمْۜ وَاِلَى اللّٰهِ تُرْجَعُ الْاُمُورُ ﴿٧٦﴾ يَٓا اَيُّهَا الَّذ۪ينَ
اٰمَنُوا ارْكَعُوا وَاسْجُدُوا وَاعْبُدُوا رَبَّكُمْ وَافْعَلُوا الْخَيْرَ لَعَلَّكُمْ تُفْلِحُونَۚ ﴿٧٧﴾ وَجَاهِدُوا فِي اللّٰهِ
حَقَّ جِهَادِهٖۜ هُوَ اجْتَبٰيكُمْ وَمَا جَعَلَ عَلَيْكُمْ فِي الدّ۪ينِ مِنْ حَرَجٍۜ

---

**74)** (مَا قَدَرُوا اللّٰهَ حَقَّ قَدْرِهٖ) – (müşriklər şirk qoşmaqla zülm edib) **Allah-Təalanı lazım olduğu kimi** (qiymətləndirib) **tanımadılar,** (اِنَّ اللّٰهَ لَقَوِيٌّ عَز۪يزٌ) - **həqiqətən, Allah-Təala qüvvətli və** (məxluqata) **qalib olandır.** (Cansız və zəif şeyləri ona necə şərik qoşmaq olar?)

**75)** (اَللّٰهُ يَصْطَف۪ي مِنَ الْمَلٰٓئِكَةِ رُسُلًا وَمِنَ النَّاسِ) – (siz müşriklər insanın peyğəmbər olmasını inkar edirsiniz, amma) **Allah-Təala mələklərdən də, insanlardan da elçilər seçər,** (mələk vasitəsilə peyğəmbərə ehkam göndərər, peyğəmbər də o ehkamı sizə çatdırar)**.** (اِنَّ اللّٰهَ سَم۪يعٌ بَص۪يرٌ) - **həqiqətən, Allah-Təala** (xalqın sözünü və əməllərini) **eşidib görəndir.**

**76)** (يَعْلَمُ مَا بَيْنَ اَيْد۪يهِمْ وَمَا خَلْفَهُمْ) - **Allah-Təala** (insanların önündəkinə də, arxasındakına da)**, keçmiş və gələcəkdəki** (bütün əməllərinə də) **agahdır.** (وَاِلَى اللّٰهِ تُرْجَعُ الْاُمُورُ) – **bütün işlərin** (sonu və) **qayıdışı Allah-Təalaya tərəfdir** (və bütün varlığın ixtiyar sahibidir. Heç kəsdə o qüdrət yoxdur ki, Allah-Təalanın hökm və tədbirinə etiraz etsin)**.**

**77)** (يَٓا اَيُّهَا الَّذ۪ينَ اٰمَنُوا ارْكَعُوا وَاسْجُدُوا وَاعْبُدُوا رَبَّكُمْ) - **ey iman gətirənlər,** (Allah-Təaladan ötrü namaz qılıb) **rüku və səcdə edin, ancaq rəbbiniz Allah-Təalaya ibadət edin.** (وَافْعَلُوا الْخَيْرَ لَعَلَّكُمْ تُفْلِحُونَ) - **yaxşı əməllər** (xeyirxahlıq, gözəl rəftar) **edin ki,** (axirət əzabından) **nicat tapasınız.**

**78)** (وَجَاهِدُوا فِي اللّٰهِ حَقَّ جِهَادِهٖ هُوَ اجْتَبٰيكُمْ) – (ey möminlər)**, Allah-Təalanın** (dininə kömək etmək üçün) **lazım olan cihadı haqqı ilə edin.** (Malla, canla, bunlardan hər hansı biri ilə olsa da, gərək çalışıb islamı ucaldasınız, Allah-Təala sizi öz dininə kömək etməniz üçün seçdi. Müsəlmanlar gərək bu dinə yardım etsinlər)**.** (وَمَا جَعَلَ عَلَيْكُمْ فِي الدّ۪ينِ مِنْ حَرَجٍ) – (Allah-Təala) **bu dində üzərinizə bir çətinlik* qoymadı.** (Bu din asan olan bir dindir)**.**

*(***Qeyd:** Necə ki Hz. Peyğəmbər özü buyurubdur: "Mən asanlıq dini ilə (islamla) göndərilmişəm." (Əhməd b. Hənbəl, Müsnəd, V/266, VI/116, 233) Ən doğru söz Allah-Təalanın sözüdür. Həqiqətən, belədir. İslamın əsl qanun və ehkamında heç bir müşkül əmr yoxdur, amma islam ümmətiın əməllərinə baxanda bəzi çətin və müşkül əmrlər görülür, onun da Allah-Təalanın göndərdiyi qanuna dəxli yoxdur, özlərini müctəhid sayanların ixtira etdikləri bir şeydir. Allah-Təala buyurub ki, islamda çətin bir əmr yoxdur. Əlbəttə, səhihdir, budur, Qurani-Şərifdə var olan bütün hökmlərin hamısı açıq və asan olan əmrlərdir. Hz. Peyğəmbərin hədisləri də belədir, bəs islam ümməti arasında mey-*

مِلَّةَ اَبِيكُمْ اِبْرٰهِيمَ هُوَ سَمّٰيكُمُ الْمُسْلِمِينَ مِنْ قَبْلُ وَفِي هٰذَا لِيَكُونَ الرَّسُولُ شَهِيدًا عَلَيْكُمْ وَتَكُونُوا شُهَدَٓاءَ عَلَى النَّاسِ فَاَقِيمُوا الصَّلٰوةَ وَاٰتُوا الزَّكٰوةَ وَاعْتَصِمُوا بِاللّٰهِ هُوَ مَوْلٰيكُمْ فَنِعْمَ الْمَوْلٰى وَنِعْمَ النَّصِيرُ ﴿٧٨﴾

---

*dana gələn müşkül əmrlər, ixtilaflar və Qurana xilaf olan sözlərin, hökmlərin qaynağı nədir? Bəli, onun bircə səbəbi var, o səbəb islam ümməti arasındakı məzhəb ixtilaflarıdır, məzhəb rəhbərlərinin öz məzhəblərini və ehkamlarını haqq, o biri məzhəb və ehkamları batil göstərmək üçün Qurani-Şərif və hədisləri bir kənara qoyub əsl bəraət (məsumiyyət), istishab (indi bilinməyən bir şeyin öncə olduğu kimi var sayılması), icma (ittifaq), mənqul (nəql edilən), qiyas (müqayisə), isaleyi-ədəm (yoxluğun var olması), isaleyi-səhhət (səhhətin olması) və bunun kimi islamın ilk dövrlərində olmayan, səhabələrin və pak imamların xəyallarına belə gəlməyən, səhih bir məxəzdən alınmayan dəlillərə və uydurma rəvayətlərə bağlanmaq səbəbindən bu ixtilaflar islam ümmətinin arasında zahir olub, dinin əmrləri çətinləşdirilib. Əgər o müşkül əmrlərin nəinki hamısını, hətta bir qismini bu kitabda zikr etsəm, həm bezdirər, həm də onlara dəyər vermiş olaram, kitabın mövzusundan da çıxmış olarıq. Allaha təvəkkül etdim və ona döndüm. Aqilə bir işarə də kifayətdir).*

(مِلَّةَ اَبِيكُمْ اِبْرٰهِيمَ) - (ey Məhəmməd, islamdakı asanlıq) **atanız İbrahimin dinində olan** (asanlıq) **kimidir.** (Hz. İbrahim Hz. Peyğəmbərin və Qüreyş camaatının əcdadı olduğundan ona ata şəklində xitab etdi)**.** (هُوَ سَمّٰيكُمُ الْمُسْلِمِينَ مِنْ قَبْلُ وَفِي هٰذَا) **- sizə müsəlman adını o** (İbrahim) **qoyubdur.** (Hz. İbrahimin sizə müsəlman adını qoyması həm) **əvvəlki** (kitablarda)**, həm də bu** (Quranda) **zikr olunubdur.** (Bəqərə surəsinin 129-cu ayəsinə baxılsın)**.** (لِيَكُونَ الرَّسُولُ شَهِيدًا عَلَيْكُمْ) – (sizə müsəlman adı qoyuldu ki, islama möhkəm yapışıb onun hökmünə əməl edəsiniz)**. Belə ki,** (qiyamət günündə bu) **peyğəmbərin** (Hz. Məhəmmədin Quranın ehkamını xalqa bildirməsinə) **şahid olasınız.** (وَتَكُونُوا شُهَدَٓاءَ عَلَى النَّاسِ) **- siz** (səhabələr və peyğəmbər də) **insanlara şahid olasınız** (ki, Quranın hökmünü onlara çatdırıbsınız. İlahi, belədir, Qurani-Şərif və onun ehkamı Hz. Peyğəmbərin səhabələri, mötəbər şəxslərin vasitəsilə bizə gəlib çatdı. Amma biz sənin Quranını tərk edib onun heç bir hökmünə əməl etməyib, fikrimiz gecə-gündüz ancaq behişt və hurilərin yanındadır)**.** (فَاَقِيمُوا الصَّلٰوةَ وَاٰتُوا الزَّكٰوةَ) **- namaz qılıb, zəkat verin.** (وَاعْتَصِمُوا بِاللّٰهِ هُوَ مَوْلٰيكُمْ) **- Allah-Təalaya möhkəm yapışıb,** (onun ehkamına əməl edin.) **Sizin köməyiniz və ixtiyarınız Allah-Təaladır.** (فَنِعْمَ الْمَوْلٰى وَنِعْمَ النَّصِيرُ) **- Allah-Təala nə yaxşı qoruyan, nə yaxşı köməkçidir.**

Allaha həmd olsun, Həcc surəsinin təfsiri bitdi, müsəlmanların bu mübarək surədə zikr olunan həccin faydasına diqqət edib düşünmələri lazımdır.



## əl-MUMİNUN SURƏSİ

23-cü surədir. Məkkədə nazil olub, 118 ayə, 1840 kəlmə, 4802 hərfdir.



بِسْمِ اللّٰهِ الرَّحْمٰنِ الرَّحِيمِ. قَدْ اَفْلَحَ الْمُؤْمِنُونَۙ ﴿١﴾ اَلَّذِينَ هُمْ فِي صَلَاتِهِمْ خَاشِعُونَۙ ﴿٢﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1)** (قَدْ اَفْلَحَ الْمُؤْمِنُونَ) **-** (ey Məhəmməd)**, möminlər** (arzularına çatıb, müşriklərə qalib gəlib) **nicat tapacaqlar.**

**2)** (اَلَّذِينَ هُمْ فِي صَلَاتِهِمْ خَاشِعُونَ) **-** (bundan sonra gələn ayələrdə möminlərin xüsusiyyəti bəyan edilir: möminlər) **o şəxslərdir ki, namaz qılanda*** (qəlbləri) **Allah qorxusu içində olub** (gözləri səcdədə olar, əbəs hərəkət etməzlər)**.**

*(*__Qeyd:__ Namaz qılanın zahiri və mənəvi xüsusiyyətini Allah-Təala belə buyurur. Namaz qılan müsəlmanlar, gərək, bu ayəyə baxıb öz namazlarından xəcalət çəkib utansınlar, Hz. Peyğəmbər namaz qılan bir şəxsin saqqalının tükləriylə oynadığını görüb buyurdu: “Əgər bu şəxsin qəlbində Allah qorxusu olsaydı, hər bir əzası da sakit olardı.” Həsən Bəsri bir şəxsin namazı qılıb qurtarandan sonra əlindəki xırda daşlarla oynayıb dua oxuduğunu gördü. Duasında belə deyirdi: “İlahi, mənə huri ver.” Həsən Bəsri dedi: “Nə pis elçilik edirsən? Birinin yanına gedib elçilik edəndə əzaların sakit olur, amma əlində daş oynadaraq Allah-Təaladan huri istəyirsən.” Bizim bu dövrdə namaz qılanlar da belədir, elə ki namazı qıldılar, günahlarından utanıb tövbə etmək əvəzinə şəhvətləri cuşa gəlib Allahdan öncə huri istəyərlər, guya elə məsciddə hurilərlə eyş-işrət edəcəklər. Biz islam ümməti arasında bu necə namaz və bu necə duadır? Hamısı adətdəndir, əgər uşaqlıqda verilən adət olmasaydı, müsəlmanların arasında namazdan da bir əlamət qalmazdı. Camaat namazının əsl ruhundan qafil olub, günorta, ya da axşam olan kimi bəzi imamlar məscidə gəlib, zöhr, ikindi, ya da axşam, işa namazları kimi iki ayrı vaxta təyin edilən namazları tənbəllikdən, hər ikisini yarım saatlıq bir vaxt içində qıldırıb, camaatı yola salıb, gedib istirahət edirlər. Bəzi imamlar da qəhvəxanalarda nərd oynarkən qulaqlarına əzan səsi dəyən kimi sürətlə məscidə gedib, camaatı gözləmədən, namazın şərtlərinə riayət etmədən zöhr, ya da axşam namazlarını qıldırıb qaçırlar. Bəziləri də qəhvəxanalarda nərd oynamaqdan evə getməyə vaxt tapmayıb, 5 vaxt namazın beşini də məsciddə qılıb gəlirlər. Bizim bu dövrdə millətimizi nur saçan Bağçasaraylı fəzilətli İsmayıl bəy “Tərcüman” adlı nəfis qəzetində camaat imamları haqqında gözəl bir yazı yazmışdı. Həqiqətən, ehtirama layiq olan bir yazı idi. Qısaca məzmunu belə idi ki, bizim imamlar namazı o qədər sürətlə qıldırırlar ki, məscidi toz bürüyür. İlahi, üləmaya qeyrət və namus, camaata da açıq göz və mərifət bəxş et).*

وَالَّذِينَ هُمْ عَنِ اللَّغْوِ مُعْرِضُونَۙ ﴿٣﴾ وَالَّذِينَ هُمْ لِلزَّكٰوةِ فَاعِلُونَۙ ﴿٤﴾ وَالَّذِينَ هُمْ لِفُرُوجِهِمْ حَافِظُونَۙ ﴿٥﴾ اِلَّا عَلٰٓى اَزْوَاجِهِمْ اَوْ مَا مَلَكَتْ اَيْمَانُهُمْ فَاِنَّهُمْ غَيْرُ مَلُومِينَۚ ﴿٦﴾ فَمَنِ ابْتَغٰى وَرَٓاءَ ذٰلِكَ فَاُو۬لٰٓئِكَ هُمُ الْعَادُونَۚ ﴿٧﴾ وَالَّذِينَ هُمْ لِاَمَانَاتِهِمْ وَعَهْدِهِمْ رَاعُونَۙ ﴿٨﴾ وَالَّذِينَ هُمْ عَلٰى صَلَوَاتِهِمْ يُحَافِظُونَۢ ﴿٩﴾ اُو۬لٰٓئِكَ هُمُ الْوَارِثُونَۙ ﴿١٠﴾

---

**3)** (وَالَّذِينَ هُمْ عَنِ اللَّغْوِ مُعْرِضُونَ) – (möminlər həm də) **o şəxslərdir ki, boş şeylərdən** (mənasız söz və əməllərdən) **üz döndərib** (tərk edərlər)**.**

**4)** (وَالَّذِينَ هُمْ لِلزَّكٰوةِ فَاعِلُونَ) – (yenə möminlər) **o şəxslərdir ki, öz mallarının zəkatını verib,** (vacib yerə çatdırırlar. Zəkat islamın əsas əmrlərindən olduğundan Allah-Təala Qurani-Şərifdə neçə yerdə zəkatın vacib olduğunu bəyan edibdir)**.**

**5)** (وَالَّذِينَ هُمْ لِفُرُوجِهِمْ حَافِظُونَ) – (bir də möminlər) **o şəxslərdir ki, öz alətlərini** (zinadan) **qoruyurlar.**

**6)** (اِلَّا عَلٰى اَزْوَاجِهِمْ اَوْ مَا مَلَكَتْ اَيْمَانُهُمْ فَاِنَّهُمْ غَيْرُ مَلُومِينَ) – **arvadları və əlləri ilə sahib olduqları** (kənizləri) **istisna olmaqla** (möminlər özlərini başqaları ilə cinsi əlaqədən qoruyarlar. Ancaq o qadınlar onlara halaldır)**. Onlar** (buna görə) **qınanmazlar.**

**7)** (فَمَنِ ابْتَغٰى وَرَٓاءَ ذٰلِكَ فَاُو۬لٰٓئِكَ هُمُ الْعَادُونَ) **- kim** (bu iki qisim* arvaddan) **artığını istəsə, həddi aşıb** (Allaha düşmən olubdur)**.**

**8)** (وَالَّذِينَ هُمْ لِاَمَانَاتِهِمْ وَعَهْدِهِمْ رَاعُونَ) – (bir də möminlər) **o şəxslərdir ki, əmanətlərini** (qoruyub) **və əhdlərinə riayət edib** (xəyanət etməzlər)**.**

**9)** (وَالَّذِينَ هُمْ عَلٰى صَلَوَاتِهِمْ يُحَافِظُونَ) – (bir də möminlər) **o şəxslərdir ki, namazlarına riayət edib** (vaxtında - 5 vaxtda qılarlar, tənbəllik etməzlər)**.**

**10)** (اُو۬لٰٓئِكَ هُمُ الْوَارِثُونَ) – (ancaq bu möminlər) **varisdirlər** (buna layiqdirlər. Əmanətə varis olanlar bunlardır:)

*(*Qeyd: Hz. Peyğəmbər islam ümməti arasında mutəni (siğəni) halal buyurandan sonra yenidən haram etməsi haqqında müsəlmanlar ixtilaf ediblər. Müsəlmanların böyük bir qismi haram olmasına, bir qismi də halal olmasına inanıblar. Halal bilənlər Hz. Peyğəmbərin halal buyurduğunu qəbul edib, sonra haram etdiyinə dair olan rəvayəti rədd ediblər. Amma mutəni haram sayanların əksəriyyəti həm bu ayəni, həm də mutənin haramlığı barəsində nəql olunan hədisi və II xəlifə Ömər ibn Xəttabın onu haram buyurduğunu qəbul edib, elə fitva veriblər. Ayə barəsində belə deyiblər: ‟mutəyə zövcə deyilməz. Zövcə o qadına deyilir ki, onun əri öləndə, ya da özü öləndə bir-birilərindən miras alsınlar. Mutədə miras olmadığından ona zövcə deyilməz. Bir də qadının libası, yemək-içməyi və bütün xərcləri ərin öhdəsindədir, gərək, əməl etsin. Mutədə bunların heç biri olmadığından bu ayədən kənar olub haram olan qadınların*

*sırasına daxil olar. Ayə ancaq iki növ qadının halal olduğuna işarə edir. Biri - daimi nikahlı arvad, o biri kəniz, yəni satın alınan qadın. Bu ikisindən başqası haramdır. Zəməxşəri "Təfsiri-Kəşşaf"da deyibdir: "Bu ayə mutənin haram olmasına işarə etmir. Mutə səhih olsaydı, ayədə zikr olunan zövcələrin sırasına daxil edilərdi." Baş qazı Şəmsəddin ibn Xəllikan mutə barəsində bir hekayə nəql edir, burada zikr etmək faydalıdır. İbn Xəllikan "Vəfəyatül-`əyan" adlı tarixi əsərində qazı Yəhya ibn Əksəmin bioqrafiyasında Məhəmməd ibn Mənsurdan belə nəql edir. Məhəmməd ibn Mənsur deyir: "Şam səfərində Abbasi xəlifəsi Məmunun xidmətində idim. Xəlifə tərəfindən əmr olundu: küçə və bazarda carçılar car çəksin ki, xəlifə belə buyurur: "Ey insanlar, mutə halaldır." Qazı Yəhya ibn Əksəm bu mətləbdən xəbərdar oldu. Minbərdə ikən Əbül-İnaya dedi: "Sabah tezdən xəlifənin hüzuruna gedək, əgər mutə barəsində danışa bilsəniz, danışın, əgər mümkün olmasa, mən gələnə qədər səbir edin." Məhəmməd ibn Mənsur deyir: "Ertəsi gün xəlifə Məmunun hüzuruna getdik. Dişlərini misvakla təmizləyirdi. Gördük, qəzəblə əyləşib, öz-özünə belə deyir: "Budur Ömərin kəlamı, deyir: "İki mutə var idi, biri – müteyi-siğə, o birisi həcdə olan mutə, yəni qadınların təvafı." Hz. Peyğəmbər zamanında və Əbu Bəkir zamanında bu iki mutə halal idi. Mən sizə o iki əməli qadağan edirəm. Bundan sonra o iki mutəni tərk edin." Ondan sonra Məmun xəlifə Ömərə xitab edib dedi: "Ey böcək, sən kimsən, nəçisən ki, peyğəmbər və Əbu Bəkir zamanında halal olan şeyi qadağan edib haram edirsən." Bu vaxt Əbül-İna Məhəmməd ibn Mənsura işarə edib dedi: "Bir kişi ki Ömər ibn Xəttab haqqında belə nalayiq söz desin, biz onunla necə danışaq?" Məhəmməd ibn Mənsur deyir: "Biz gözlədik, elə ki, qazı Yəhya rəngi qaçmış halda gəlib əyləşdi, biz də əyləşdik, Məmun dönüb Yəhyaya dedi: "Sənin əhvalını dəyişik görürəm, səbəb nədir?" Dedi: "Bəli, islamda bir bidət yarandığından mənə qəm-qüssə üz veribdir." Xəlifə dedi: "İslamda nə bidət peyda olubdur?" Qazı dedi: "Zinanın halal olduğunu əmr edibsiniz." Xəlifə dedi: "Mutə zinadır?" Dedi: "Bəli, zinadır." Xəlifə dedi: "Niyə belə deyirsən?" Qazı dedi: "Allah-Təalanın kitabı, bir də peyğəmbərin hədisi belə deyir." Qazı "Kim bu iki qisim xanımdan başqa (qadınlarla cinsi əlaqədə olsa) bunlar həddi aşan şəxslərdir" ayəsini oxudu, ondan sonra dedi: "Ya əmirəl-möminin, mutə kənizdir?" Xəlifə dedi: "Kəniz deyil." Dedi: "Mutə miras alan qadınlardandır?" Xəlifə dedi: "O qadınlardan deyil." Qazı dedi: "Deməк mutə ayədə zikr olunan iki qisim qadınlardan olmayıb haram oldu. Bu ayədir, hədis də budur: Zühri Məhəmməd Hənəfinin oğulları olan Abdullah və Həsəndən, onlar da ataları Məhəmməd Hənəfidən, o da atası Əli ibn Əbu Talibdən rəvayət edib buyurur: "Hz. Peyğəmbər mənə mutənin haram olmasını xalqa bildirməyi əmr etdi." Məhəmməd ibn Mənsur deyir: "Məmun bizə dönüb dedi: "Bu hədisi siz də Zühridən rəvayət edirsiniz?" Dedik: "Bəli, ya əmirəl-möminin, bu hədisi Malik ibn Ənəs də daxil olmaqla bir qrup adam nəql edib." Məmun tövbə edib əmr etdi: "Yenidən mutənin haram olmasını elan edin." İbn Xəllikanın rəvayəti bitdi. Bəziləri bu rəvayəti Xeybər savaşında Hz. Əlidən nəql ediblər, buyurur: "Xeybərdə Hz. Peyğəmbər iki şeyi haram buyurdu, bir mutəni, bir də eşşəyin ətini." (Səhihi-Buxari, Nikah, 12; Müslüm, Nikah, 29; Nəsai, Nikah 7; Tusi, Təhzib, 7/251; İstibsar, 3/3/142) İnsaf üzrə baxanda Zəməxşərinin dediyi kimi ayə mutənin haramlığına işarə etmir. Amma əgər bu hədis Əli ibn Əbu Talibdən səhih olaraq nəql olunsaydı, niyə Ömər ibnül-Xəttab mutənin haram olmasını bu rəvayətə isnad verməyib, - "gedin bunu nəql edən Əli ibn Əbu Talibdən soruşun, bəlkə, özündən deyir," -demişdir? Peyğəmbərdən başqa, heç kim*

اَلَّذِينَ يَرِثُونَ الْفِرْدَوْسَ هُمْ فِيهَا خَالِدُونَ ﴿١١﴾ وَلَقَدْ خَلَقْنَا الْاِنْسَانَ مِنْ سُلَالَةٍ مِنْ طِينٍۚ ﴿١٢﴾
ثُمَّ جَعَلْنَاهُ نُطْفَةً فِي قَرَارٍ مَكِينٍۖ ﴿١٣﴾

---

*haram, halal əmri verə bilməz. Əgər bu hədis doğru olsaydı, peyğəmbərdən sonra xəlifələrin zamanında məşhur olub mutənin haram olmasında şübhə olmayıb, ibn Abbas və onun kimi başqalarından da mutənin halal olması rəvayəti gəlməzdi. Həm də əks təqdirdə, Əli ibn Əbu Talibin pak övladları olan imamlar da mutənin halal olması haqda necə fitva verərdilər? Bu hədis, səhih hədis şərtlərinə uyğun düşmür.Bir də mutənin halal olması hikmət üzrə olub, insanları zinadan qorumaqdan ötrü lazımdır. Asi bir şəxs gözəl üzlü qadın görəndə özünü saxlaya bilməsin, bu tərəfdən mutə də haram olsun, bəs bu şəxsin zinaya düşməsi təhlükəli deyilmi? Bu halda, təqlidi kənara qoyub, dini düşünərək mutənin halal olduğunu qəbul etmək lazımdır. Əgər nurlu şəriət onu halal etməsəydi də, dinin hikməti onun halal olmasını zəruri edərdi. Halbuki ilk dövrlərdə mutənin halal olması islam ümmətinin icmasıyla sabit ikən belə qeyri-mötəbər hədislərə əsaslanıb, onu haram saymaq ağıl karı deyil. Əgər mənə irad tutub desələr ki, sən də bu mətləbi təqliddə əsaslanıb yazırsan, Allah-Təala şahiddir ki, mən bu sözü təqlidlə demirəm, bəlkə, öz aciz düşüncəmə görə, hikmət və dinin həqiqətini düşünərək bu mətləbi zikr edirəm. Necə ki müqəddəs şəriət sahibi də bu hikməti düşünüb, mutənin halal olmasını əmr etmişdir. Allah tərəfgirlikdən və təqliddən qorusun!)*

**11)** (اَلَّذِينَ يَرِثُونَ الْفِرْدَوْسَ هُمْ فِيهَا خَالِدُونَ) **- onlar elə şəxslərdir ki,** (Allah-Təalanın uca) **firdövs cənnətinə varis olarlar.** (Yəni miras alanlar kimi bu cənnətə malik olacaqlar)**, həmişə orada qalıb** (heç vaxt çıxmayacaqlar. Bundan sonra gələn ayələrdə Allah-Təala insanı necə yaradıb, sonra öldürüb, ondan sonra dirildib, məhşərə götürməsi haqqında öz kamil qüdrətini bəyan edir. Allah-Təala insanın yaradılışını Qurani-Şərifdə bir neçə yerdə bəyan etməsi təkrar kimi görünsə də, amma insan yaradılarkən bir neçə hal keçirtdiyindən, hər bəyanda onun yeni bir halı izah edilir)**.**

**12)** (وَلَقَدْ خَلَقْنَا الْاِنْسَانَ مِنْ سُلَالَةٍ مِنْ طِينٍ) **- həqiqətən, insanı** (babanız Adəmi) **xalis palçıqdan yaratdıq.** (Yəni öncə palçığı saflaşdırıb, xalis palçıq edib ondan sonra Adəmi o saf palçıqdan yaratdıq. Adəmi yaradarkən mərhələ-mərhələ öncə qara qoxmuş palçıqdan, sonra palçıqdan və bu ayədə göstərildiyi kimi, saf xalis palçıqdan yaratdıq. Bir başqa yerdə də belə buyurur: "Quru palçıqdan yaratdıq". Bu neçə yerdə Adəmin yaradılışını müxtəlif şəkildə bəyan etməkdən məqsəd onun əsl maddəsinin bu müxtəlif xüsusiyyətlərdən ibarət olduğunu göstərməkdir, öncə onun maddəsi qara qoxmuş palçıq olub, ondan sonra suyu çəkilib qoxusu götürülüb, ondan sonra saf, xalis palçıq olub və sonra quru palçıq olub, ondan sonra Adəm olubdur. Amma o quru palçıq necə dönüb ət, qan, sümük olubdur, onu ancaq Allah-Təala bilir)**.**

**13)** (ثُمَّ جَعَلْنَاهُ نُطْفَةً فِي قَرَارٍ مَكِينٍ) – (Adəmin - insanın ilk maddəsini palçıq edəndən) **sonra** (sizin cövhərinizi) **sperma edib** (ana rəhmində) **yerləşdirdik.**

ثُمَّ خَلَقْنَا النُّطْفَةَ عَلَقَةً فَخَلَقْنَا الْعَلَقَةَ مُضْغَةً فَخَلَقْنَا الْمُضْغَةَ عِظَامًا فَكَسَوْنَا الْعِظَامَ لَحْمًا ثُمَّ
اَنْشَأْنَاهُ خَلْقًا اٰخَرَ فَتَبَارَكَ اللّٰهُ اَحْسَنُ الْخَالِقِينَ ﴿١٤﴾ ثُمَّ اِنَّكُمْ بَعْدَ ذٰلِكَ لَمَيِّتُونَ ﴿١٥﴾ ثُمَّ اِنَّكُمْ
يَوْمَ الْقِيٰمَةِ تُبْعَثُونَ ﴿١٦﴾ وَلَقَدْ خَلَقْنَا فَوْقَكُمْ سَبْعَ طَرَآئِقَ وَمَا كُنَّا عَنِ الْخَلْقِ غَافِلِينَ ﴿١٧﴾
وَاَنْزَلْنَا مِنَ السَّمَآءِ مَآءً بِقَدَرٍ فَاَسْكَنَّاهُ فِي الْاَرْضِ وَاِنَّا عَلٰى ذَهَابٍ بِهٖ لَقَادِرُونَ ﴿١٨﴾

---

**14)** (ثُمَّ خَلَقْنَا النُّطْفَةَ عَلَقَةً) **- ondan sonra spermanı** (40 gün içində çevirib) **bir parça qan etdik.** (فَخَلَقْنَا الْعَلَقَةَ مُضْغَةً) **- sonra bir parça qanı bir** (kiçik) **ət parçası etdik.** (فَخَلَقْنَا الْمُضْغَةَ عِظَامًا) **- sonra o ət parçasını sümüklərə çevirdik.** (فَكَسَوْنَا الْعِظَامَ لَحْمًا) **– sonra o sümükləri ətdən** (libasla) **örtdük.** (İnsan ana qarnında bu halətlərdə olan zaman hələ ona ruh daxil olmayıb cansız maddə kimi olur). (ثُمَّ اَنْشَأْنَاهُ خَلْقًا اٰخَرَ) **- sonra** (o cansız şeyi) **başqa bir məxluq olaraq yaratdıq.** (Yəni cansız olandan sonra ona ruh daxil edib ağıl, şüur, göz, qulaq, sair əzalar sahibi gözəl bir canlı şəkildə yaratdıq). (فَتَبَارَكَ اللّٰهُ) **-** (Allah-Təala insanı belə gözəl yaratdığı üçün özünü vəsf edib buyurur:) **Allah-Təala** (elm və qüdrətində) **nə qədər uca,** (həmd-sənaya layiq olan yeganə yaradıcıdır). (اَحْسَنُ الْخَالِقِينَ) **–** (naxış çəkib) **təqdir, təyin edənlərin ən gözəli Allah-Təaladır** (ki, əzəli elmi ilə belə gözəl bir surətdə insanı rəsm edib yaradıbdır).

**15)** (ثُمَّ اِنَّكُمْ بَعْدَ ذٰلِكَ لَمَيِّتُونَ) **- ondan sonra, həqiqətən,** (yaradılışınız tamam olub dünyaya gəlib, təyin edilən ömrünüz bitəndən sonra) **mütləq öləcəksiniz.**

**16)** (ثُمَّ اِنَّكُمْ يَوْمَ الْقِيٰمَةِ تُبْعَثُونَ) **–** (öləndən) **sonra, həqiqətən, qiyamət günü dirilib** (məhşərə götürüləcəksiniz).

**17)** (وَلَقَدْ خَلَقْنَا فَوْقَكُمْ سَبْعَ طَرَآئِقَ) **- həqiqətən,** (başınızın) **üzərində* 7 səma yaratdıq** (ki, onların mənfəəti sizə aid olsun).

*(*Qeyd: Səma bizim başımızın yuxarı tərəfinə deyilir. İnsanın dünyadan mənfəət alması bu dünyanı əhatə edən hava səbəbilədir, havasız heç bir canlı yaşaya bilməyəcəyindən həyatın ilk şərti hava hesab olunur. Hava bizim bu yer kürəsini hər bir tərəfdən təqribən 10 ağac qalınlığında əhatə edibdir. Yuxarıya getdikcə havanın təbəqələri də müxtəlif olub, hər bir təbəqəsində fərqli xüsusiyyətlər olduğundan ayədə 7 səma adıyla adlandı).*

(وَمَا كُنَّا عَنِ الْخَلْقِ غَافِلِينَ) **–** (ey Məhəmməd)**, biz məxluqatdan da qafil deyilik.** (Onların mənfəətini düşünüb 7 səma yaradıb ruzi qapısını onların üzünə açıb, bol nemət verdik).

**18)** (وَاَنْزَلْنَا مِنَ السَّمَآءِ مَآءً بِقَدَرٍ فَاَسْكَنَّاهُ فِي الْاَرْضِ) **–** (təqdir və tədbirimizə görə) **səmadan bir miqdar su endirib onu yerdə saxladıq** (ki, insanlar ehtiyaclarını onunla həll edib mənfəət əldə etsinlər). (وَاِنَّا عَلٰى ذَهَابٍ بِهٖ لَقَادِرُونَ) **–** (səmadan su endirib saxlaya bildiyimiz kimi) **həqiqətən, o suyu aparıb** (yox edib, susuz-

فَاَنْشَأْنَا لَكُمْ بِهٖ جَنَّاتٍ مِنْ نَخِيلٍ وَاَعْنَابٍ لَكُمْ فِيهَا فَوَاكِهُ كَثِيرَةٌ وَمِنْهَا تَأْكُلُونَۙ ﴿١٩﴾ وَشَجَرَةً تَخْرُجُ مِنْ طُورِ سَيْنَاءَ تَنْبُتُ بِالدُّهْنِ وَصِبْغٍ لِلْاٰكِلِينَ ﴿٢٠﴾ وَاِنَّ لَكُمْ فِي الْاَنْعَامِ لَعِبْرَةً نُسْقِيكُمْ مِمَّا فِي بُطُونِهَا وَلَكُمْ فِيهَا مَنَافِعُ كَثِيرَةٌ وَمِنْهَا تَأْكُلُونَۙ ﴿٢١﴾ وَعَلَيْهَا وَعَلَى الْفُلْكِ تُحْمَلُونَ۟ ﴿٢٢﴾ وَلَقَدْ اَرْسَلْنَا نُوحًا اِلٰى قَوْمِهٖ

---

luqla sizi həlak etməyə də) **qadirik.** (İnsanlar ən çox suya görə, Allaha şükür etməlidirlər ki, məişətləri ona bağlıdır. Əgər dünyanın bütün xəzinələri bir şəxsin ixtiyarında olsa və o şəxsin də həyatı tapılmayan bir qurtum suya bağlı olsa, o su üçün bütün xəzinəsini verər ki, onu əldə etsin. Bu mətləbdən suyun nə böyük nemət olduğu məlum olur)**.**

**19)** (فَاَنْشَأْنَا لَكُمْ بِهٖ جَنَّاتٍ مِنْ نَخِيلٍ وَاَعْنَابٍ) – (o su səbəbilə) **sizdən ötrü xurma və üzüm bağları yaratdıq.** (لَكُمْ فِيهَا فَوَاكِهُ كَثِيرَةٌ وَمِنْهَا تَأْكُلُونَ) – (o bağlarda) **sizdən ötrü çox meyvələr var ki,** (o meyvələrdən mənfəət alıb) **yeyirsiniz.** (İlahi, necə ki buyurubsan, nə yaxşı, nə gözəl bağlar, sular və o bağlarda gözəl meyvələr bizə bəxş edibsən. Amma bizim dilimiz onlara layiqi ilə şükür etməkdən acizdir)**.**

**20)** (وَشَجَرَةً تَخْرُجُ مِنْ طُورِ سَيْنَاءَ) – (yenə sizdən ötrü o su səbəbilə) **Turi-Sinadan** (Musanın Allaha dua etdiyi Sina dağından) **çıxan** (zeytun) **ağacını** (yaratdıq. Bu ayələrdə Allah-Təalanın məqsədi ilk olaraq meyvələri və zeytun ağacını yaratmasını bildirməkdir ki, Ona şükür edək. Dünyada zeytun ağacı ilk dəfə Sina dağından çıxdığından Allah-Təala bunu bizə xəbər verir)**.** (تَنْبُتُ بِالدُّهْنِ وَصِبْغٍ لِلْاٰكِلِينَ) – **o,** (həm yandırmaqdan ötrü, həm də) **yeyənlər üçün zeytun, yağ bitirər.** (Zeytun ağacı digər ağaclardan daha çox mənfəətli olduğundan Allah-Təala onu xüsusi bildirir)**.**

**21)** (وَاِنَّ لَكُمْ فِي الْاَنْعَامِ لَعِبْرَةً نُسْقِيكُمْ مِمَّا فِي بُطُونِهَا)**- həqiqətən, heyvanlarda** (dəvə, öküz, qoyun, keçi) **sizin üçün ibrət vardır.** (Gərək, onların varlığına baxıb Allah-Təalanın tövhid və qüdrətinə agah olasınız)**. Biz onların qarınlarından** (çıxan süddən) **sizə içirdirik.** (وَلَكُمْ فِيهَا مَنَافِعُ كَثِيرَةٌ وَمِنْهَا تَأْكُلُونَ) **- sizin üçün** (o heyvanların varlığında südlərindən başqa da) **bir çox mənfəətlər vardır,** (ətindən də) **yeyirsiniz.**

**22)** (وَعَلَيْهَا وَعَلَى الْفُلْكِ تُحْمَلُونَ) – **həm** (o heyvanların) **həm də gəmilərin üstünə** (minib) **daşınırsınız.**

**23)** (وَلَقَدْ اَرْسَلْنَا نُوحًا اِلٰى قَوْمِهٖ) **-** (əvvəlki ayələrdə Allah-Təala bəndələrinə bəxş etdiyi nemətləri zikr etdi. Nemətlərin ən böyüyü Allah-Təala tərəfindən gələn peyğəmbərlər olub, ilk öncə o nemətlərə şükür etmək vacibdir. Amma insanlar o nemətlərin qədrini bilməyib nankor olduqlarından Allah-Təala bu

فَقَالَ يَا قَوْمِ اعْبُدُوا اللّٰهَ مَا لَكُمْ مِنْ اِلٰهٍ غَيْرُهُ اَفَلَا تَتَّقُونَ ﴿٢٣﴾ فَقَالَ الْمَلَؤُا الَّذِينَ كَفَرُوا مِنْ قَوْمِهِ
مَا هٰذَآ اِلَّا بَشَرٌ مِثْلُكُمْ يُرِيدُ اَنْ يَتَفَضَّلَ عَلَيْكُمْ وَلَوْ شَآءَ اللّٰهُ لَاَنْزَلَ مَلٰٓئِكَةً مَا سَمِعْنَا بِهٰذَا فِٓي
اٰبَآئِنَا الْاَوَّلِينَ ﴿٢٤﴾ اِنْ هُوَ اِلَّا رَجُلٌ بِهِ جِنَّةٌ فَتَرَبَّصُوا بِهِ حَتّٰى حِينٍ ﴿٢٥﴾ قَالَ رَبِّ انْصُرْنِي بِمَا
كَذَّبُونِ ﴿٢٦﴾ فَاَوْحَيْنَآ اِلَيْهِ اَنِ اصْنَعِ الْفُلْكَ بِاَعْيُنِنَا وَوَحْيِنَا فَاِذَا جَآءَ اَمْرُنَا وَفَارَ التَّنُّورُ فَاسْلُكْ
فِيهَا مِنْ كُلٍّ زَوْجَيْنِ اثْنَيْنِ

---

ayədə peyğəmbərlərin əhvalatını bəyan edir. Ayənin mənası belədir, buyurur:) **həqiqətən, biz Nuhu öz qövmünə peyğəmbər göndərdik,** (belə ki, qövmünü bizim tərəfimizə dəvət edib bütpərəstlikdən xilas etsin)**.** (فَقَالَ يَا قَوْمِ اعْبُدُوا اللّٰهَ مَا لَكُمْ مِنْ اِلٰهٍ غَيْرُهُ اَفَلَا تَتَّقُونَ) – (Nuh qövmünü dəvət edib) **dedi: "Ey mənim qövmüm,** (yeganə olan) **Allah-Təalaya ibadət edib** (bütləri tərk edin)**, sizdən ötrü Allah-Təaladan başqa heç bir** (haqq) **məbud yoxdur.** (Yeganə olan Allah-Təalaya ibadəti tərk edib, Onun nemətlərinə nankor olub, layiq olmayan cansız şeylərə ibadət etməkdən qorxmursunuz?)"

**24)** (فَقَالَ الْمَلَؤُا الَّذِينَ كَفَرُوا مِنْ قَوْمِهِ) – (Nuh bu sözü deyəndən sonra) **qövmünün kafir olan böyükləri** (Nuha bir söz deməyib camaata belə) **dedilər:** (مَا هٰذَآ اِلَّا بَشَرٌ مِثْلُكُمْ يُرِيدُ اَنْ يَتَفَضَّلَ عَلَيْكُمْ) – (ey camaat, bu Nuh da) **sizin kimi bir insandır.** (İnsandan peyğəmbər olmaz)**. İstəyir ki, sizə böyüklük etsin.** (وَلَوْ شَآءَ اللّٰهُ لَاَنْزَلَ مَلٰٓئِكَةً) **- əgər Allah istəsəydi, mələklər göndərib** (ehkamını sizə elə bildirərdi)**.** (مَا سَمِعْنَا بِهٰذَا فِٓي اٰبَآئِنَا الْاَوَّلِينَ) – **öncəki ata-babalarımızdan eşitməmişik ki,** (Allah insandan peyğəmbər göndərsin. Müşriklər insanın peyğəmbər olmasına razı olmayıb, cansız şeyləri məbud saydılar. Zəlalətin ən yüksək dərəcəsi budur. Bu kəlamdan anlaşılır ki, Nuhun qövmü Nuhdan əvvəl heç bir peyğəmbərə tabe olmamışdı)**.**

**25)** (اِنْ هُوَ اِلَّا رَجُلٌ بِهِ جِنَّةٌ) – (bu Nuh) **dəliliyi olan bir adamdır** (Dəlinin sözünə qulaq asmazlar)**.** (فَتَرَبَّصُوا بِهِ حَتّٰى حِينٍ) – (səbir edib) **bir müddət gözləyin** (ki, bu iş aydınlansın, əgər dəlilikdən qurtulsa, əlbəttə, belə sözlər deməz, amma əgər bu halda qalıb bu sözləri təkrar etsə, o vaxt onu öldürərsiniz)**.**

**26)** (قَالَ رَبِّ انْصُرْنِي بِمَا كَذَّبُونِ) **-** (Nuh 950 il öz qövmünü dəvət edib, amma imana gəlmədilər. Axırda Nuh bezib onlara bəd dua edib) **dedi: "Rəbbim, məni təkzib edib** (sənin ehkamına itaət etmədikləri üçün) **mənə kömək olub** (bunları həlak et)**."**

**27)** (فَاَوْحَيْنَآ اِلَيْهِ اَنِ اصْنَعِ الْفُلْكَ بِاَعْيُنِنَا وَوَحْيِنَا) – (Nuha) **vəhy edib** (dedik: ey Nuh, sənə olan kömək və nəzarətimizlə)**, gözümüzün önündə və öyrətməyimizlə gəmini düzəlt,** (فَاِذَا جَآءَ اَمْرُنَا وَفَارَ التَّنُّورُ) – (ey Nuh, qövmünün həlak olması haqqında) **əmrimiz sənə gəldikdə,** (yerdən su) **qaynayıb daşar.** (فَاسْلُكْ فِيهَا مِنْ كُلٍّ زَوْجَيْنِ اثْنَيْنِ) – (ey Nuh, bunu gördükdə)**, hər növ** (heyvandan) **bir cüt** (bir

وَاَهْلَكَ اِلَّا مَنْ سَبَقَ عَلَيْهِ الْقَوْلُ مِنْهُمْۚ وَلَا تُخَاطِبْنِي فِي الَّذِينَ ظَلَمُواۚ اِنَّهُمْ مُغْرَقُونَ ﴿٢٧﴾ فَاِذَا
اسْتَوَيْتَ اَنْتَ وَمَنْ مَعَكَ عَلَى الْفُلْكِ فَقُلِ الْحَمْدُ لِلّٰهِ الَّذِي نَجّٰينَا مِنَ الْقَوْمِ الظَّالِمِينَ ﴿٢٨﴾ وَقُلْ
رَبِّ اَنْزِلْنِي مُنْزَلًا مُبَارَكًا وَاَنْتَ خَيْرُ الْمُنْزِلِينَ ﴿٢٩﴾ اِنَّ فِي ذٰلِكَ لَاٰيَاتٍ وَاِنْ كُنَّا لَمُبْتَلِينَ ﴿٣٠﴾ ثُمَّ
اَنْشَاْنَا مِنْ بَعْدِهِمْ قَرْنًا اٰخَرِينَۚ ﴿٣١﴾ فَاَرْسَلْنَا فِيهِمْ رَسُولًا مِنْهُمْ اَنِ اعْبُدُوا اللّٰهَ مَا لَكُمْ مِنْ اِلٰهٍ غَيْرُهُۜ
اَفَلَا تَتَّقُونَۚ ﴿٣٢﴾ وَقَالَ الْمَلَاُ مِنْ قَوْمِهِ الَّذِينَ كَفَرُوا وَكَذَّبُوا بِلِقَٓاءِ الْاٰخِرَةِ وَاَتْرَفْنَاهُمْ فِي الْحَيٰوةِ الدُّنْيَاۙ

---

erkək, bir dişi) **gəmiyə daxil et.** (وَاَهْلَكَ اِلَّا مَنْ سَبَقَ عَلَيْهِ الْقَوْلُ مِنْهُمْ) **- bir də** (küfrləri səbəbilə) **əleyhlərinə** (Allah-Təala tərəfindən ölüm) **hökmü verilənlər istisna olmaqla ailəni gəmiyə mindir.** (Nuhun arvadı, bir də oğlu Kənan kafir olub həlak oldular). (وَلَا تُخَاطِبْنِي فِي الَّذِينَ ظَلَمُواۚ اِنَّهُمْ مُغْرَقُونَ) - (ey Nuh, qövmün qərq olanda onlara rəhmin gəlsə də)**, zülm edənlərə görə, mənə dua edib** (nicat istəmə)**, həqiqətən, onlar qərq olacaqlar.** (Nicat tapmaları mümkün deyil)**.**

**28)** (فَاِذَا اسْتَوَيْتَ اَنْتَ وَمَنْ مَعَكَ عَلَى الْفُلْكِ) – (ey Nuh)**, yanındakı** (möminlərlə) **gəmiyə minib** (arxayın olduğunuzda)**,** (فَقُلِ الْحَمْدُ لِلّٰهِ الَّذِي نَجّٰينَا مِنَ الْقَوْمِ الظَّالِمِينَ) **- de ki, bizi zalım camaatdan qurtaran** (yeganə) **Allah-Təalaya həmd olsun.**

**29)** (وَقُلْ رَبِّ اَنْزِلْنِي مُنْزَلًا مُبَارَكًا) - (ey Nuh, yenə duada belə) **de: "Ey mənim rəbbim,** (gəmidən çıxanda) **məni bərəkətli və xeyirli bir yerə endir.** (وَاَنْتَ خَيْرُ الْمُنْزِلِينَ) **– məskən verənlərin ən yaxşısı sənsən.**

**30)** (اِنَّ فِي ذٰلِكَ لَاٰيَاتٍ وَاِنْ كُنَّا لَمُبْتَلِينَ) **- həqiqətən, bu** (Nuh qövmünün əhvalatında Allah-Təalanın tövhid və qüdrətinə dair) **dəlil və sübutlar vardır, həqiqətən,** (Nuh qövmünü imtahan edib böyük) **bəla və müsibətə düçar etdik** (onlardan sonra gələn ümmətlər ibrət alsınlar ki, Allah-Təala zalım şəxslərə necə cəza verir)**.**

**31)** (ثُمَّ اَنْشَاْنَا مِنْ بَعْدِهِمْ قَرْنًا اٰخَرِينَ) - (ey Məhəmməd, Nuh camaatını həlak edəndən) **sonra başqa bir camaat yaratdıq.**

**32)** (فَاَرْسَلْنَا فِيهِمْ رَسُولًا مِنْهُمْ) **- onlara özlərindən bir peyğəmbər göndərdik.** (Allah-Təala bu camaatın və bu peyğəmbərin adını zikr etməyibdir. Hansı camaat və hansı peyğəmbərdir, məlum deyil)**.** (اَنِ اعْبُدُوا اللّٰهَ مَا لَكُمْ مِنْ اِلٰهٍ غَيْرُهُ اَفَلَا تَتَّقُونَ) – (o peyğəmbər onları Allah-Təala tərəfinə dəvət edib dedi: yeganə olan) **Allah-Təalaya ibadət edin. Sizdən ötrü başqa** (haqq) **məbud yoxdur.** (Cansız şeyləri ona şərik qoşub ibadət etməklə) **Allah-Təaladan qorxmursunuz?**

**33)** (وَقَالَ الْمَلَاُ مِنْ قَوْمِهِ الَّذِينَ كَفَرُوا وَكَذَّبُوا بِلِقَٓاءِ الْاٰخِرَةِ وَاَتْرَفْنَاهُمْ فِي الْحَيٰوةِ الدُّنْيَا) – (o peyğəmbərin) **qövmündən kafir olub, axirətə qovuşmağı yalanlayan və dünya neməti verdiyimiz böyüklər** (peyğəmbərə cavab vermək əvəzində

مَا هٰذَآ اِلَّا بَشَرٌ مِثْلُكُمْ يَأْكُلُ مِمَّا تَأْكُلُونَ مِنْهُ وَيَشْرَبُ مِمَّا تَشْرَبُونَ ﴿٣٣﴾ وَلَئِنْ اَطَعْتُمْ بَشَرًا مِثْلَكُمْ
اِنَّكُمْ اِذًا لَخَاسِرُونَ ﴿٣٤﴾ اَيَعِدُكُمْ اَنَّكُمْ اِذَا مِتُّمْ وَكُنْتُمْ تُرَابًا وَعِظَامًا اَنَّكُمْ مُخْرَجُونَ ﴿٣٥﴾ هَيْهَاتَ
هَيْهَاتَ لِمَا تُوعَدُونَ ﴿٣٦﴾ اِنْ هِيَ اِلَّا حَيَاتُنَا الدُّنْيَا نَمُوتُ وَنَحْيَا وَمَا نَحْنُ بِمَبْعُوثِينَ ﴿٣٧﴾ اِنْ هُوَ اِلَّا
رَجُلٌ افْتَرٰى عَلَى اللّٰهِ كَذِبًا وَمَا نَحْنُ لَهُ بِمُؤْمِنِينَ ﴿٣٨﴾ قَالَ رَبِّ انْصُرْنِي بِمَا كَذَّبُونِ ﴿٣٩﴾ قَالَ عَمَّا
قَلِيلٍ لَيُصْبِحُنَّ نَادِمِينَ ﴿٤٠﴾ فَاَخَذَتْهُمُ الصَّيْحَةُ بِالْحَقِّ فَجَعَلْنَاهُمْ غُثَآءً فَبُعْدًا لِلْقَوْمِ الظَّالِمِينَ ﴿٤١﴾

---

camaata belə) **dedilər:** (مَا هٰذَآ اِلَّا بَشَرٌ مِثْلُكُمْ يَأْكُلُ مِمَّا تَأْكُلُونَ مِنْهُ) **- bu da sizin kimi bir insandır. Siz yeyən yeməkdən yeyir.** (وَيَشْرَبُ مِمَّا تَشْرَبُونَ) **- siz içən sudan içir,** (belə şəxsdən peyğəmbər olmaz. Peyğəmbər gərək, mələk, olsun)**.**

**34)** (وَلَئِنْ اَطَعْتُمْ بَشَرًا مِثْلَكُمْ اِنَّكُمْ اِذًا لَخَاسِرُونَ) **- əgər özünüz kimi insana itaət edib** (onu peyğəmbər bilsəniz)**, həqiqətən, o zaman özünüzə zərər verənlərdən olarsınız.**

**35)** (اَيَعِدُكُمْ اَنَّكُمْ اِذَا مِتُّمْ وَكُنْتُمْ تُرَابًا وَعِظَامًا اَنَّكُمْ مُخْرَجُونَ) **- o, sizə ölüb torpaq və sür-sümük olandan sonra** (qəbirdən dirilib) **çıxacağınızı vəd edir?**

**36)** (هَيْهَاتَ هَيْهَاتَ لِمَا تُوعَدُونَ) **- sizə vəd edilən şey** (qiyamət) **çox uzaqdır, çox uzaq.** (Yəni qiyamət günündə dirilmək mümkün deyil)**.**

**37)** (اِنْ هِيَ اِلَّا حَيَاتُنَا الدُّنْيَا) **– bizim bu dünya həyatından başqası yoxdur.** (نَمُوتُ وَنَحْيَا) **–** (bir qismimiz) **ölər,** (bir qismimiz dirilib) **dünyaya gələrik.** (وَمَا نَحْنُ بِمَبْعُوثِينَ) **– dirildilib** (məhşərə gedən deyilik)**.**

**38)** (اِنْ هُوَ اِلَّا رَجُلٌ افْتَرٰى عَلَى اللّٰهِ كَذِبًا وَمَا نَحْنُ لَهُ بِمُؤْمِنِينَ) **- bu şəxs ancaq Allah-Təalaya yalandan iftira edir, biz ona iman gətirib** (təsdiq edən deyilik)**.**

**39)** (قَالَ رَبِّ انْصُرْنِي بِمَا كَذَّبُونِ) – (o peyğəmbər qövmünün iman etməsindən ümidini kəsdikdə, dua edib) **dedi: "Rəbbim, məni təkzib edib** (iman etmədikləri üçün) **mənə kömək edib** (onlardan intiqam al)**."**

**40)** (قَالَ عَمَّا قَلِيلٍ لَيُصْبِحُنَّ نَادِمِينَ) – (Allah-Təala) **buyurdu: "Bir az sonra** (əzab gəlib, səni təkzib edib kafir olmaqlarına) **peşman olacaqlar."** (O vaxt da o peşmanlıq onlara bir fayda verməz)**.**

**41)** (فَاَخَذَتْهُمُ الصَّيْحَةُ بِالْحَقِّ) – (ölüm anı gəldikdə, onlara zülm olunmayıb, öz əməlləri səbəbinə ildırım kimi) **şiddətli səs onları yaxaladı.** (فَجَعَلْنَاهُمْ غُثَآءً) – (onları həlak edib sellə axan) **saman çöpü kimi etdik.** (فَبُعْدًا لِلْقَوْمِ الظَّالِمِينَ) **- zalım olan camaat** (Allah-Təalanın rəhmətindən uzaq olub) **məhv olsun.** (Elə də oldu)**.**

ثُمَّ اَنْشَأْنَا مِنْ بَعْدِهِمْ قُرُونًا اٰخَرِينَ ﴿٤٢﴾ مَا تَسْبِقُ مِنْ اُمَّةٍ اَجَلَهَا وَمَا يَسْتَأْخِرُونَ ﴿٤٣﴾ ثُمَّ اَرْسَلْنَا رُسُلَنَا تَتْرَاۜ كُلَّمَا جَٓاءَ اُمَّةً رَسُولُهَا كَذَّبُوهُ فَاَتْبَعْنَا بَعْضَهُمْ بَعْضًا وَجَعَلْنَاهُمْ اَحَادِيثَۚ فَبُعْدًا لِقَوْمٍ لَا يُؤْمِنُونَ ﴿٤٤﴾ ثُمَّ اَرْسَلْنَا مُوسٰى وَاَخَاهُ هٰرُونَ بِاٰيَاتِنَا وَسُلْطَانٍ مُبِينٍۙ ﴿٤٥﴾ اِلٰى فِرْعَوْنَ وَمَلَا۬ئِهٖ فَاسْتَكْبَرُوا وَكَانُوا قَوْمًا عَالِينَۚ ﴿٤٦﴾ فَقَالُٓوا اَنُؤْمِنُ لِبَشَرَيْنِ مِثْلِنَا وَقَوْمُهُمَا لَنَا عَابِدُونَۚ ﴿٤٧﴾ فَكَذَّبُوهُمَا فَكَانُوا مِنَ الْمُهْلَكِينَ ﴿٤٨﴾ وَلَقَدْ اٰتَيْنَا مُوسَى الْكِتَابَ لَعَلَّهُمْ يَهْتَدُونَ ﴿٤٩﴾

---

**42)** (ثُمَّ اَنْشَأْنَا مِنْ بَعْدِهِمْ قُرُونًا اٰخَرِينَ) **- ondan sonra** (yer üzündə) **başqa-başqa camaatlar yaratdıq.** (Onlara peyğəmbər gəlsə də, iman etməyib asi olduqlarından onları da həlak etdik)**.**

**43)** (مَا تَسْبِقُ مِنْ اُمَّةٍ اَجَلَهَا وَمَا يَسْتَأْخِرُونَ) **- heç bir** (asi) **ümmət** (onlara əzab gəlib həlak olacaqları) **vaxtı nə qabağa sala bilər, nə də gecikdirə bilər.**

**44)** (ثُمَّ اَرْسَلْنَا رُسُلَنَا تَتْرَا) – (o camaatları həlak edəndən) **sonra bir-birinin dalınca** (digər ümmətlərə) **peyğəmbərlərimizi göndərdik.** (كُلَّمَا جَٓاءَ اُمَّةً رَسُولُهَا كَذَّبُوهُ) – (hər dəfə) **hər bir ümmətə öz peyğəmbəri gəldikdə, o peyğəmbəri təkzib edib** (iman gətirmədilər)**.** (فَاَتْبَعْنَا بَعْضَهُمْ بَعْضًا) – (təkzib etdikləri üçün o ümmətlərə əzab göndərib) **bir-birinin dalınca onları həlak etdik.** (وَجَعَلْنَاهُمْ اَحَادِيثَ) – (onların özlərini və məhv olmalarını ibrətamiz) **qissələr etdik** (ki, özlərindən sonra gələnlər danışıb ibrət alsınlar)**.** (فَبُعْدًا لِقَوْمٍ لَا يُؤْمِنُونَ) – (Allah-Təalaya) **iman gətirməyən qövm** (Onun rəhmətindən uzaq olub) **həlak olsun.** (Necə ki elə də oldu)**.**

**45)** (ثُمَّ اَرْسَلْنَا مُوسٰى وَاَخَاهُ هٰرُونَ بِاٰيَاتِنَا وَسُلْطَانٍ مُبِينٍ) **- ondan sonra Musa və qardaşı Harunu möcüzələrimiz, açıq-aşkar dəlil və sübutla peyğəmbər göndərdik.**

**46)** (اِلٰى فِرْعَوْنَ وَمَلَا۬ئِهٖ) **– firon və onun ətrafında olan əyan-əşrafa** (göndərdik ki, bizim tərəfimizə dəvət etsinlər), (فَاسْتَكْبَرُوا وَكَانُوا قَوْمًا عَالِينَ) **– təkəbbürlənib, özlərini ulu sayan** (zalım) **qövm olduqlarından** (Musa və Haruna itaət etmədilər)**.**

**47)** (فَقَالُٓوا اَنُؤْمِنُ لِبَشَرَيْنِ مِثْلِنَا وَقَوْمُهُمَا لَنَا عَابِدُونَ) – (firon və əyan-əşrafı) **dedi: "Bunların qövmü** (bəni-İsrail) **bizə qul olub** (itaət etdiyi halda)**, biz özümüz kimi iki insana iman edib** (itaət edək)**?"**

**48)** (فَكَذَّبُوهُمَا فَكَانُوا مِنَ الْمُهْلَكِينَ) – (ey Məhəmməd, Musa və Harunu) **təkzib edib** (itaət etmədilər)**, o səbəbdən** (dənizdə qərq olub) **həlak olanlardan oldular.**

**49)** (وَلَقَدْ اٰتَيْنَا مُوسَى الْكِتَابَ لَعَلَّهُمْ يَهْتَدُونَ) **– (həqiqətən, biz fironu həlak edəndən sonra Musaya kitab** (Tövrat) **verdik ki, bəlkə** (bəni-İsrail) **hidayət ta-**

وَجَعَلْنَا ابْنَ مَرْيَمَ وَاُمَّهُ اٰيَةً وَاٰوَيْنَاهُمَآ اِلٰى رَبْوَةٍ ذَاتِ قَرَارٍ وَمَعِينٍ ﴿٥٠﴾ يَآ اَيُّهَا الرُّسُلُ كُلُوا مِنَ
الطَّيِّبَاتِ وَاعْمَلُوا صَالِحًاۜ اِنّ۪ي بِمَا تَعْمَلُونَ عَل۪يمٌۜ ﴿٥١﴾ وَاِنَّ هٰذِه۪ٓ اُمَّتُكُمْ اُمَّةً وَاحِدَةً وَاَنَا رَبُّكُمْ
فَاتَّقُونِ ﴿٥٢﴾ فَتَقَطَّعُٓوا اَمْرَهُمْ بَيْنَهُمْ زُبُرًاۜ كُلُّ حِزْبٍ بِمَا لَدَيْهِمْ فَرِحُونَ ﴿٥٣﴾ فَذَرْهُمْ ف۪ي
غَمْرَتِهِمْ حَتّٰى ح۪ينٍ ﴿٥٤﴾

---

**pıb** (firon və onun camaatı kimi zəlalətə vaqe olmasınlar. Amma onlar da Tövrata əməl etməyib, itaətdən çıxdılar və bəlalara düçar oldular)**.**

**50)** (وَجَعَلْنَا ابْنَ مَرْيَمَ وَاُمَّهُٓ اٰيَةً) **- Məryəm oğlu** (İsanı) **və anası** (Məryəmi tövhidimizə işarə edən) **əlamət etdik.** (وَاٰوَيْنَاهُمَٓا اِلٰى رَبْوَةٍ ذَاتِ قَرَارٍ وَمَع۪ينٍ) – (İsanı yəhudilərdən qorumaq üçün ana və oğul hər ikisini) **abad və axar sulu uca bir yerdə yerləşdirdik.** (Yəni Məryəmin nişanlısı Yusif yəhudilərin qorxusundan Məryəmi və oğlu İsanı götürüb Misirə getdi. Həmin mətləbi Allah-Təala ayədə xəbər verir)**.**

**51)** (يَٓا اَيُّهَا الرُّسُلُ كُلُوا مِنَ الطَّيِّبَاتِ وَاعْمَلُوا صَالِحًا) **-** (ey Məhəmməd, hər bir dövrdə göndərilən peyğəmbərə xitab edib demişik:) **ey peyğəmbərlər,** (insan təbiətinin çəkinmədiyi) **pak ruzilərdən yeyib yaxşı əməllər edin.** (اِنّ۪ي بِمَا تَعْمَلُونَ عَل۪يمٌ) **- həqiqətən, mən sizin hər bir əməlinizdən agaham.**

**52)** (وَاِنَّ هٰذِه۪ٓ اُمَّتُكُمْ اُمَّةً وَاحِدَةً) – (siz peyğəmbərlərin) **hamınızın** (dini və) **ümməti tək bir** (din və) **ümmətdir,** (dininiz tövhidə inanıb, Allah-Təala ehkamına əməl etməkdir)**.** (وَاَنَا رَبُّكُمْ فَاتَّقُونِ) **- rəbbiniz də mənəm,** (əzabımdan) **çəkinin.**

**53)** (فَتَقَطَّعُٓوا اَمْرَهُمْ بَيْنَهُمْ زُبُرًا) – (o peyğəmbərlərin ümmətləri) **öz** (din) **işlərini aralarında parçalayıb* dəstə-dəstə oldular.** (Hər dəstə özündən ötrü bir din və bir məzhəb yaratdı)**.** (كُلُّ حِزْبٍ بِمَا لَدَيْهِمْ فَرِحُونَ) – (bu ixtilaf edən dəstələrin) **hər biri də özlərindəki din** (və məzhəbə) **sevinib,** (digərlərini batil hesab etdilər)**.**

***(*Qeyd:** Bu xəbərin doğruluğu neçə əsrlərdir islam ümmətinin içində təsdiq olub, rəy sahiblərinin icad etdiyi məzhəblər günbəgün yayılıb, yeni-yeni firqələr peyda olub, bir-birilərini küfr və zəlalətə isnad edirlər. Qeybə agah olmadığımızdan ola bilər ki, Allah-Təala bu dəstələrin bir-biriləri haqqında dedikləri sözləri təsdiq edib, heç biri nicat tapmasın. Qurani-Şərifin sözləri türk dilində deyilən kimi, qızım, sənə deyirəm, gəlinim sən eşit, məsəli kimidir. Keçmiş peyğəmbərlərin və onların ümmətlərinin qissələrinin ehtiva etdiyi nəsihət və öyüdlərin hamısı biz müsəlmanlara da aiddir).*

**54)** (فَذَرْهُمْ ف۪ي غَمْرَتِهِمْ حَتّٰى ح۪ينٍ) – (ey Məhəmməd, müşrik və asiləri) **müəyyən bir vaxta kimi öz küfr və zəlalətlərində burax.** (Belə ki, öldürülüb, ya da özləri ölsünlər)**.**

اَيَحْسَبُونَ اَنَّمَا نُمِدُّهُمْ بِهٖ مِنْ مَالٍ وَبَنٖينَۙ ﴿٥٥﴾ نُسَارِعُ لَهُمْ فِي الْخَيْرَاتِۜ بَلْ لَا يَشْعُرُونَ ﴿٥٦﴾ اِنَّ الَّذٖينَ هُمْ مِنْ خَشْيَةِ رَبِّهِمْ مُشْفِقُونَۙ ﴿٥٧﴾ وَالَّذٖينَ هُمْ بِاٰيَاتِ رَبِّهِمْ يُؤْمِنُونَۙ ﴿٥٨﴾ وَالَّذٖينَ هُمْ بِرَبِّهِمْ لَا يُشْرِكُونَۙ ﴿٥٩﴾ وَالَّذٖينَ يُؤْتُونَ مَٓا اٰتَوْا وَقُلُوبُهُمْ وَجِلَةٌ اَنَّهُمْ اِلٰى رَبِّهِمْ رَاجِعُونَۙ ﴿٦٠﴾ اُو۬لٰٓئِكَ يُسَارِعُونَ فِي الْخَيْرَاتِ وَهُمْ لَهَا سَابِقُونَ ﴿٦١﴾ وَلَا نُكَلِّفُ نَفْسًا اِلَّا وُسْعَهَا وَلَدَيْنَا كِتَابٌ يَنْطِقُ بِالْحَقِّ وَهُمْ لَا يُظْلَمُونَ ﴿٦٢﴾

---

**55-56)** (اَيَحْسَبُونَ اَنَّمَا نُمِدُّهُمْ بِهٖ مِنْ مَالٍ وَبَنٖينَ نُسَارِعُ لَهُمْ فِي الْخَيْرَاتِ) – **bəlkə** (bu kafir və müşriklər) **elə zənn edirlər ki, onlara verdiyimiz mal-dövlət və oğulları onlara** (xeyir vermək üçün)**, yaxşı əməllərindən razı qaldığımız üçün bəxş etmişik?** (Elə deyildir)**.** (بَلْ لَا يَشْعُرُونَ) – **xeyr, onlar** (heyvan kimi şüursuz olub) **heç düşünmürlər** (ki, bu nemətlər onların əzabını daha da artırır. Çünki bu nemətlərin müqabilində Allah-Təalaya şükür etməyin əvəzində kafir olub Ondan başqasına sitayiş edirlər. Xeyir əməl sahibləri bundan sonra gələn ayələrdə zikr olunanlardır)**.**

**57)** (اِنَّ الَّذٖينَ هُمْ مِنْ خَشْيَةِ رَبِّهِمْ مُشْفِقُونَ) - (ey Məhəmməd)**, həqiqətən, o şəxslər ki, öz rəbləri Allah-Təalaya qarşı təvazödən** (və onun əzabından) **qorxu içində olur,**

**58)** (وَالَّذٖينَ هُمْ بِاٰيَاتِ رَبِّهِمْ يُؤْمِنُونَ) **O şəxslər ki öz Rəbləri Allah-Təalanın ayələrinə inanırlar.**

**59)** (وَالَّذٖينَ هُمْ بِرَبِّهِمْ لَا يُشْرِكُونَ) **- və o şəxslər ki, öz rəbləri Allah-Təalanın ibadətinə heç bir şərik qoşmurlar,**

**60)** (وَالَّذٖينَ يُؤْتُونَ مَٓا اٰتَوْا وَقُلُوبُهُمْ وَجِلَةٌ) **- və o şəxslər ki, ürəkləri** (verdiklərinin qəbul olunmayacağı) **qorxusu içində** (Allah-Təala yolunda zəkat, sədəqə) **verirlər,** (اَنَّهُمْ اِلٰى رَبِّهِمْ رَاجِعُونَ) – (qorxarlar ki,) **rəbləri Allah-Təalanın hüzuruna dönüb** (sorğu-sual olunacaqlar)**.**

**61)** (اُو۬لٰٓئِكَ يُسَارِعُونَ فِي الْخَيْرَاتِ وَهُمْ لَهَا سَابِقُونَ) – **bu** (ayədə zikr olunan şəxslər) **hər bir xeyir əməldə tələsərlər və bu işdə öndədirlər.** (Allah-Təala onlardan razı qaldığı üçün, xeyir əməllərinə görə, belə şəxslərə dünya mənfəəti verər, nəinki müşrik və kafirlərə bu səbəblə verər)**.**

**62)** (وَلَا نُكَلِّفُ نَفْسًا اِلَّا وُسْعَهَا) – (bu zikr olunan sifətlər möminlərin gücü daxilindədir)**. Biz heç kimə gücü çatacağından artıq təklif etmərik.** (وَلَدَيْنَا كِتَابٌ يَنْطِقُ بِالْحَقِّ) - (ey Məhəmməd)**, möminlərin heç bir əməli yanımızda zay olmaz. Bizim yanımızda haqqı deyən bir kitab** (lövhi-məhfuz) **var.** (Onda yazılan şeylər heç vaxt zay olmaz)**.** (وَهُمْ لَا يُظْلَمُونَ) **- onlara zülm olunmayıb** (əməllərinin əcr və savabları əskildilməz)**.**

بَلْ قُلُوبُهُمْ فِي غَمْرَةٍ مِنْ هٰذَا وَلَهُمْ اَعْمَالٌ مِنْ دُونِ ذٰلِكَ هُمْ لَهَا عَامِلُونَ ﴿٦٣﴾ حَتّٰٓى اِذَٓا اَخَذْنَا
مُتْرَفِيهِمْ بِالْعَذَابِ اِذَا هُمْ يَجْـَٔرُونَ ﴿٦٤﴾ لَا تَجْـَٔرُوا الْيَوْمَ اِنَّكُمْ مِنَّا لَا تُنْصَرُونَ ﴿٦٥﴾ قَدْ كَانَتْ اٰيَاتِي
تُتْلٰى عَلَيْكُمْ فَكُنْتُمْ عَلٰٓى اَعْقَابِكُمْ تَنْكِصُونَ ﴿٦٦﴾ مُسْتَكْبِرِينَ بِهٖ سَامِرًا تَهْجُرُونَ ﴿٦٧﴾ اَفَلَمْ يَدَّبَّرُوا
الْقَوْلَ اَمْ جَٓاءَهُمْ مَا لَمْ يَأْتِ اٰبَٓاءَهُمُ الْاَوَّلِينَ ﴿٦٨﴾ اَمْ لَمْ يَعْرِفُوا رَسُولَهُمْ فَهُمْ لَهُ مُنْكِرُونَ ﴿٦٩﴾

---

**63)** (بَلْ قُلُوبُهُمْ فِي غَمْرَةٍ مِنْ هٰذَا) – (möminlərin zikr olunan əməlləri bunlardır. Amma kafir və müşriklərin) **qəlbləri bu əməllərdən** (dərin) **qəflət içindədir.** (O qəflət yuxusundan oyanmayacaqlar)**.** (وَلَهُمْ اَعْمَالٌ مِنْ دُونِ ذٰلِكَ هُمْ لَهَا عَامِلُونَ) – (o kafirlərin möminlərin əməllərindən) **başqa** (xəbis) **əməlləri də var, o əməlləri edərlər,** (nəinki möminlərin əməllərini)**.**

**64)** (حَتّٰٓى اِذَٓا اَخَذْنَا مُتْرَفِيهِمْ بِالْعَذَابِ اِذَا هُمْ يَجْـَٔرُونَ) **-** (ey Məhəmməd, kafir və müşriklər öz xəbis əməllərindən ayrılmazlar)**. O vaxta kimi ki, biz onların bolluq içində olan başçılarını** (Bədir günündə) **əzabla yaxalayaq,** (ya öldürək, ya da əsir edək. Onları yaxaladıqda da əzabın qorxusundan) **ah-nalə edib** (Allah-Təaladan yardım və nicat istərlər. Bu ayə Hz. Peyğəmbərə Bədir qələbəsini vəd edir.)

**65)** (لَا تَجْـَٔرُوا الْيَوْمَ اِنَّكُمْ مِنَّا لَا تُنْصَرُونَ) – (o vaxt da bizim tərəfimizdən onlara deyilər, yəni ey Məhəmməd, sən deyərsən:) **heç nalə və fəryad etməyin. Bu gün bizdən sizə kömək olunmaz.**

**66)** (قَدْ كَانَتْ اٰيَاتِي تُتْلٰى عَلَيْكُمْ فَكُنْتُمْ عَلٰٓى اَعْقَابِكُمْ تَنْكِصُونَ) **- həqiqətən, bizim** (Quran) **ayələrimiz sizə oxunanda, ona arxa çevirib** (iman gətirmirdiniz)**.**

**67)** (مُسْتَكْبِرِينَ بِهٖ سَامِرًا تَهْجُرُونَ) – (Qurana qarşı) **təkəbbürlənib, gecələr** (Kəbənin ətrafında oturub Qurana gah sehr, gah şeir deyib) **boş-boş** (nalayiq) **danışırdınız.**

**68)** (اَفَلَمْ يَدَّبَّرُوا الْقَوْلَ) **-** (ey Məhəmməd, bəs bu müşriklər bu Qurani-Kərimin) **sözlərini heç düşünmürlər** (ki, onun haqq olduğunu bilib ona iman gətirsinlər)**.** (اَمْ جَٓاءَهُمْ مَا لَمْ يَأْتِ اٰبَٓاءَهُمُ الْاَوَّلِينَ) (ey Məhəmməd)**, bəlkə** (ona görə səni inkar edirlər ki,) **keçmiş ata-babalarına gəlməyən** (kitab və peyğəmbər) **onlara gəlib?** (Əgər belə güman edirlərsə, bu güman batildir. Onların ata-babalarından ötrü də İbrahim və İsmayılın ehkamı, başqa peyğəmbərlər də gəlib)**.**

**69)** (اَمْ لَمْ يَعْرِفُوا رَسُولَهُمْ فَهُمْ لَهُ مُنْكِرُونَ) **-** (ey Məhəmməd)**, yoxsa** (bu müşriklər) **peyğəmbərlərini** (yəni səni) **tanımayıb, o səbəbdən inkar edirlər?** (Halbuki sənin soyunu, əmanətə sadiqliyini, ağıl və fərasətini, elm və kamalını çox yaxşı bildikləri halda, inkar edirlər. Hz. Peyğəmbər Xədicə ilə evlənəndə Əbu Talibin oxuduğu xütbə onun fəzilət və kamilliyinə kafi dəlildir)**.**

اَمْ يَقُولُونَ بِهٖ جِنَّةٌ ۜ بَلْ جَٓاءَهُمْ بِالْحَقِّ وَاَكْثَرُهُمْ لِلْحَقِّ كَارِهُونَ ﴿٧٠﴾ وَلَوِ اتَّبَعَ الْحَقُّ اَهْوَٓاءَهُمْ
لَفَسَدَتِ السَّمٰوَاتُ وَالْاَرْضُ وَمَنْ فِيهِنَّ بَلْ اَتَيْنَاهُمْ بِذِكْرِهِمْ فَهُمْ عَنْ ذِكْرِهِمْ مُعْرِضُونَ ﴿٧١﴾ اَمْ
تَسْـَٔلُهُمْ خَرْجًا فَخَرَاجُ رَبِّكَ خَيْرٌ ۗ وَهُوَ خَيْرُ الرَّازِقِينَ ﴿٧٢﴾

---

**70)** (اَمْ يَقُولُونَ بِهٖ جِنَّةٌ) **- yoxsa deyirlər ki,** (bu Məhəmməddə) **dəlilik var,** (heç onda belə bir şey görüblər ki, ona isnad edirlər?) (بَلْ جَٓاءَهُمْ بِالْحَقِّ وَاَكْثَرُهُمْ لِلْحَقِّ كَارِهُونَ) **– xeyr,** (elə deyil, peyğəmbər) **haqq olan** (Quranla) **onlara gəldi, onların da əksəriyyəti haqqı xoşlamırlar.**

*(*__Qeyd:__ Zəməxşəri "Kəşşaf"da belə deyir: "Əgər desən ki, müşriklərin az bir qisminin haqdan və Qurandan acıqları gəlmirdi, demək doğru deyil. Buna belə cavab verərik: həqiqətən də, Qüreyş camaatının bir qisminin Qurani-Şərifə heç bir etirazı olmayıb, amma xalqın məzəmməti, ata–babalarının dinindən çıxıblar qınağı onların imana girməsinə mane oldu. Necə ki Əbu Talib haqqında belə deyirlər. Əgər desən ki, müsəlmanların bəzisi Əbu Talibin mömin olduğunu deyir. Belə cavab verərik: Allah böyükdür! Guya Əbu Talib peyğəmbərin digər əmilərindən az tanınırdı. Sanki Həmzə və Abbasın imanı bilinib də, onun imanı gizlin qalmışdı. Halbuki Əbu Talib bütün Qüreyşdə ən birinci şəxs hesab olunurdu. Necə olur ki belə şəxs iman gətirib imanı məxfi qalsın. Bəlkə, Əbu Talibin Qurani-Şərifə və islama etirazı olmayıb, amma xalqın məzəmmətindən, əcdadlarının dinindən dönüb demələrindən utanıb, bütpərəstlikdə qaldı və islama girmədi." Zəməxşərinin sözü bitdi).*

(Ona görə, peyğəmbərə iman gətirmədilər. Yoxsa onda dəlilik var demək bəhanədir)**.**

**71)** (وَلَوِ اتَّبَعَ الْحَقُّ اَهْوَٓاءَهُمْ) - (ey Məhəmməd)**, əgər haqq** (müşriklərin) **rəyinə tabe olub onların nəfsani istəkləri kimi vaqe olsaydı,** (لَفَسَدَتِ السَّمٰوَاتُ وَالْاَرْضُ وَمَنْ فِيهِنَّ) **- hər halda o vaxt da** (haqq* dönüb batil olub, aləmin nizamı pozulub) **səmalarda və yerdə, onlarda olan** (məxluqatın) **arasında fəsad peyda olub** (davam etməzdilər)**.** (بَلْ اَتَيْنَاهُمْ بِذِكْرِهِمْ فَهُمْ عَنْ ذِكْرِهِمْ مُعْرِضُونَ) **– xeyr, biz onlara** (haqqı aşkar etməkdən ötrü içində öyüd-nəsihət və şərəf olan) **bir kitab** (Quran) **gətirdik. Lakin onlar** (haqqı inkar etdiklərindən) **onlara edilən öyüd-nəsihətdən** (şərəflərindən) **üz döndərib** (zəlalət içində qaldılar)**.**

*(__Qeyd:__ haqq, yəni hər bir şey öz yerində və vaxtında hikmət üzrə vaqe olar, heç kimin rəyinə tabe olmaz).*

**72)** (اَمْ تَسْـَٔلُهُمْ خَرْجًا) - (ey Məhəmməd)**, yoxsa sən onlardan bir az xərclik** (bəxşiş) **istəyirsən,** (o səbəbdən, bəlkə, səndən uzaqlaşırlar?) (فَخَرَاجُ رَبِّكَ خَيْرٌ وَهُوَ خَيْرُ الرَّازِقِينَ) – (halbuki sən onlardan heç bir şey istəmirsən)**, rəbbin Allah-Təalanın bəxşişləri** (onların az olan bəxşişindən) **yaxşıdır və ruzi verənlərin ən yaxşısı Allah-Təaladır.**

وَاِنَّكَ لَتَدْعُوهُمْ اِلٰى صِرَاطٍ مُسْتَقِيمٍ ﴿٧٣﴾ وَاِنَّ الَّذِينَ لَا يُؤْمِنُونَ بِالْاٰخِرَةِ عَنِ الصِّرَاطِ لَنَاكِبُونَ ﴿٧٤﴾ وَلَوْ رَحِمْنَاهُمْ وَكَشَفْنَا مَا بِهِمْ مِنْ ضُرٍّ لَلَجُّوا فِي طُغْيَانِهِمْ يَعْمَهُونَ ﴿٧٥﴾ وَلَقَدْ اَخَذْنَاهُمْ بِالْعَذَابِ فَمَا اسْتَكَانُوا لِرَبِّهِمْ وَمَا يَتَضَرَّعُونَ ﴿٧٦﴾ حَتّٰى اِذَا فَتَحْنَا عَلَيْهِمْ بَابًا ذَا عَذَابٍ شَدِيدٍ اِذَا هُمْ فِيهِ مُبْلِسُونَ ﴿٧٧﴾ وَهُوَ الَّذِي اَنْشَاَ لَكُمُ السَّمْعَ وَالْاَبْصَارَ وَالْاَفْئِدَةَ قَلِيلًا مَا تَشْكُرُونَ ﴿٧٨﴾

---

**73)** (وَاِنَّكَ لَتَدْعُوهُمْ اِلٰى صِرَاطٍ مُسْتَقِيمٍ) - (ey Məhəmməd)**, həqiqətən, sən onları düz yola hidayət edirsən.** (Niyə səndən qaçıb imana daxil olmurlar?)

**74)** (وَاِنَّ الَّذِينَ لَا يُؤْمِنُونَ بِالْاٰخِرَةِ عَنِ الصِّرَاطِ لَنَاكِبُونَ) **- həqiqətən, o şəxslər ki, axirətə** (və qiyamət gününə) **iman gətirmir, onlar düz yoldan** (haqq yoldan) **kənara düşüb** (zəlalət içində qalıblar)**.**

**75)** (وَلَوْ رَحِمْنَاهُمْ وَكَشَفْنَا مَا بِهِمْ مِنْ ضُرٍّ) **-** (Qüreyş camaatı Hz. Peyğəmbərə çox əziyyətlər verəndən sonra Allah-Təala Qüreyş camaatını aclığa düçar edib aralarında qəhətlik peyda oldu. Əbu Süfyan Hz. Peyğəmbərin hüzuruna gedib dedi: "Səni and verirəm Allah-Təalaya və qohum-əqrəba haqqına, bəs sən demirsən ki, Allah-Təala məni aləmlərə rəhmət göndəribdir?" Hz. Peyğəmbər buyurubdur: "Elədir." Əbu Süfyan dedi: "Aclıq bizi həlak edib, camaat bir dəri və bir sümük qalıb, dəvənin tükünü qanıyla bişirib elə yeyirlər. Dua et, Allah-Təala bu qıtlığı bizdən qaldırsın." Hz. Peyğəmbərin duası ilə Allah-Təala o qıtlığı onlardan götürüb, ruzi qapısını üzlərinə açdı. O vaxt da bu ayə nazil oldu. Ayənin mənası belədir:) **əgər biz** (o Qüreyş camaatına) **rəhm edib,** (qıtlıq) **bəlasını onlardan qaldırsaq,** (necə ki peyğəmbərimizin duasıyla açıb götürdük)**,** (لَلَجُّوا فِي طُغْيَانِهِمْ يَعْمَهُونَ) **–** (hər halda Hz. Peyğəmbərə yalvardıqlarını unudub əvvəlki kimi peyğəmbər və möminlərə qarşı ədavətlərinə)**, təkəbbürlərinə inadla davam edərlər.**

**76)** (وَلَقَدْ اَخَذْنَاهُمْ بِالْعَذَابِ) **- həqiqətən, biz** (Qüreyş müşriklərini qıtlıq) **əzabına düçar etdik** (ki, bəlkə qorxub itaət edib, Allah-Təalaya şərik qoşmasınlar)**.** (فَمَا اسْتَكَانُوا لِرَبِّهِمْ وَمَا يَتَضَرَّعُونَ) **- amma** (Qüreyş camaatı) **yenə öz rəbləri Allah-Təalaya boyun əyməyib yalvarmadılar,** (küfr və inadlarına davam etdilər)**.**

**77)** (حَتّٰى اِذَا فَتَحْنَا عَلَيْهِمْ بَابًا ذَا عَذَابٍ شَدِيدٍ اِذَا هُمْ فِيهِ مُبْلِسُونَ) **–** (müşriklər heç vaxt Allah-Təalaya zillət içində yalvarmazlar)**,** (qiyamət günündə şiddətli) **əzab qapısını onların üzünə açarıq, o vaxt da** (hər bir xeyirdən) **ümidsiz olub** (çaşqın qalarlar)**.**

**78)** (وَهُوَ الَّذِي اَنْشَاَ لَكُمُ السَّمْعَ وَالْاَبْصَارَ وَالْاَفْئِدَةَ قَلِيلًا مَا تَشْكُرُونَ) **–** (Allah-Təala öz kamil qüdrəti ilə yox yerdən) **sizin üçün qulaqlar, gözlər və qəlblər yaradıb,** (gərək, siz də Allah-Təalanın ayələrini qulağınızla eşidib, gözünüzlə onun hə-

وَهُوَ الَّذِي ذَرَاَكُمْ فِي الْاَرْضِ وَاِلَيْهِ تُحْشَرُونَ ﴿٧٩﴾ وَهُوَ الَّذِي يُحْيِ وَيُمِيتُ وَلَهُ اخْتِلَافُ الَّيْلِ
وَالنَّهَارِ اَفَلَا تَعْقِلُونَ ﴿٨٠﴾ بَلْ قَالُوا مِثْلَ مَا قَالَ الْاَوَّلُونَ ﴿٨١﴾ قَالُوا ءَاِذَا مِتْنَا وَكُنَّا تُرَابًا وَعِظَامًا
ءَاِنَّا لَمَبْعُوثُونَ ﴿٨٢﴾ لَقَدْ وُعِدْنَا نَحْنُ وَاٰبَاۤؤُنَا هٰذَا مِنْ قَبْلُ اِنْ هٰذَاۤ اِلَّاۤ اَسَاطِيرُ الْاَوَّلِينَ ﴿٨٣﴾ قُلْ
لِمَنِ الْاَرْضُ وَمَنْ فِيهَاۤ اِنْ كُنْتُمْ تَعْلَمُونَ ﴿٨٤﴾ سَيَقُولُونَ لِلّٰهِ قُلْ اَفَلَا تَذَكَّرُونَ ﴿٨٥﴾

---

qiqətini dərk edib, qəlbinizlə Allah-Təalanın tövhidinə inanasınız. Amma siz insanlar Allah-Təalanın verdiyi bu qulaq, göz, qəlb nemətlərinə) **çox az şükür edib,** (onları layiq olduğu yerdə istifadə etmirsiniz. Necə ki zikr olundu)**.**

**79)** (وَهُوَ الَّذِي ذَرَاَكُمْ فِي الْاَرْضِ وَاِلَيْهِ تُحْشَرُونَ) – (Allah-Təala öz kamil qüdrəti ilə) **sizi yer üzündə yaradıb yayıb,** (hamınızı öləndən sonra yenidən yaradacaq)**, onun hüzuruna** (qayıdıb) **toplanacaqsınız.**

**80)** (وَهُوَ الَّذِي يُحْيِ وَيُمِيتُ) **- sizi dirildib öldürən Allah-Təaladır.** (Sizin dirilib ölməyiniz hər ikisi Allah-Təalanın qüdrəti daxilindədir)**.** (وَلَهُ اخْتِلَافُ الَّيْلِ وَالنَّهَارِ اَفَلَا تَعْقِلُونَ) **- gecə-gündüzün bir- birinin dalınca gedib-gəlməsi də Allah-Təalanın əmri ilədir.** (Ondan başqa, heç kim buna qadir deyil)**. Bəs dərk edib anlamırsınız?**

**81)** (بَلْ قَالُوا مِثْلَ مَا قَالَ الْاَوَّلُونَ) **-** (ey Məhəmməd)**, bəlkə, müşriklər onlardan əvvəlki** (kafirlərin) **dediyini dedilər.** (Növbəti ayədə nə dedikləri bəyan olunur)**.**

**82)** (قَالُوا ءَاِذَا مِتْنَا وَكُنَّا تُرَابًا وَعِظَامًا ءَاِنَّا لَمَبْعُوثُونَ) **-** (müşriklər) **dedilər: yoxsa biz ölüb,** (çürüyüb) **torpaq və sür-sümük olandan sonra dirilib** (məhşərə gedəcəyik)**?**

**83)** (لَقَدْ وُعِدْنَا نَحْنُ وَاٰبَاۤؤُنَا هٰذَا مِنْ قَبْلُ) **- həqiqətən,** (dirilib məhşərə getməyi Məhəmməd) **bizə vəd etdi. Bundan qabaq ata-babalarımıza da bu vəd verilmişdi.** (Amma onlardan bir şey məlum olmadı)**.** (اِنْ هٰذَاۤ اِلَّاۤ اَسَاطِيرُ الْاَوَّلِينَ) **- bu** (söz) **əvvəlkilərin əfsanələrindən başqa, bir şey deyil.**

**84)** (قُلْ لِمَنِ الْاَرْضُ وَمَنْ فِيهَاۤ اِنْ كُنْتُمْ تَعْلَمُونَ) – (ey Məhəmməd, müşriklərə) **de ki, əgər bilirsinizsə, bu yer və onda olan məxluqat kimindir** (və kimin ixtiyarındadır?)

**85)** (سَيَقُولُونَ لِلّٰهِ قُلْ اَفَلَا تَذَكَّرُونَ) **- əlbəttə,** (müşriklər belə) **deyəcəklər:** (yerin və ondakı məxluqatın ixtiyarı) **Allah-Təalaya məxsusdur.** (Ey Məhəmməd, onlara de ki, bunu bilirsinizsə)**, niyə ibrət alıb düşünmürsünüz?** (Bir Allah-Təala ki yeri və onda olan məxluqatı ilk dəfə yaratmağa qadir olsun, öləndən sonra da onları diriltməyə qadir olmazmı?)

قُلْ مَنْ رَبُّ السَّمٰوَاتِ السَّبْعِ وَرَبُّ الْعَرْشِ الْعَظِيمِ ﴿٨٦﴾ سَيَقُولُونَ لِلّٰهِ قُلْ اَفَلَا تَتَّقُونَ ﴿٨٧﴾
قُلْ مَنْ بِيَدِهٖ مَلَكُوتُ كُلِّ شَيْءٍ وَهُوَ يُجِيرُ وَلَا يُجَارُ عَلَيْهِ اِنْ كُنْتُمْ تَعْلَمُونَ ﴿٨٨﴾ سَيَقُولُونَ لِلّٰهِ
قُلْ فَاَنّٰى تُسْحَرُونَ ﴿٨٩﴾ بَلْ اَتَيْنَاهُمْ بِالْحَقِّ وَاِنَّهُمْ لَكَاذِبُونَ ﴿٩٠﴾ مَا اتَّخَذَ اللّٰهُ مِنْ وَلَدٍ وَمَا كَانَ
مَعَهُ مِنْ اِلٰهٍ اِذًا لَذَهَبَ كُلُّ اِلٰهٍ بِمَا خَلَقَ وَلَعَلَا بَعْضُهُمْ عَلٰى بَعْضٍ سُبْحَانَ اللّٰهِ عَمَّا يَصِفُونَ ﴿٩١﴾

---

**86)** (قُلْ مَنْ رَبُّ السَّمٰوَاتِ السَّبْعِ وَرَبُّ الْعَرْشِ الْعَظِيمِ) - (ey Məhəmməd, müşriklərə) **de ki, 7 səmanın və böyük ərşin rəbbi** (və sahibi) **kimdir?** (7 səmanın nə olduğu bu surədə 18-ci ayənin təfsirində keçdi. Oraya baxılsın. Ərş isə taxt mənasındadır. Allah-Təalanın ərşin sahibi olması onun bütün varlığa hakim olması deməkdir)**.**

**87)** (سَيَقُولُونَ لِلّٰهِ قُلْ اَفَلَا تَتَّقُونَ) – (əlbəttə, sənin cavabında) **deyərlər:** (səmanın və ərşin tərbiyə verən rəbbi) **Allah-Təaladır.** (Onları yaradan və idarə edən Allah-Təaladır. Ey Məhəmməd, onlara) **de ki, bəs Allah-Təaladan qorxma-yıb** (yenə Ondan başqasına ibadət edib şərik qoşursunuz?)

**88)** (قُلْ مَنْ بِيَدِهٖ مَلَكُوتُ كُلِّ شَيْءٍ) – (ey Məhəmməd, müşriklərə) **de ki, hər bir şeyin hökmü öz əlində olan kimdir?** (وَهُوَ يُجِيرُ وَلَا يُجَارُ عَلَيْهِ اِنْ كُنْتُمْ تَعْلَمُونَ) **– o, istəsə hər kəsi** (bəladan) **qoruyar, heç kim də onun əzabından bir başqası-nı qoruya bilməz. Əgər bilirsinizsə,** (deyin: o, kimdir?)

**89)** (سَيَقُولُونَ لِلّٰهِ قُلْ فَاَنّٰى تُسْحَرُونَ) – (əlbəttə, o vaxt da müşriklər) **deyərlər:** (ey Məhəmməd, bu xüsusiyyətlər) **Allah-Təalaya məxsusdur.** (Ey Məhəmməd, onlara) **de: "O zaman niyə** (şeytana) **aldanıb** (Allah-Təalaya itaətsizlik edib Ona şərik qoşursunuz?)"

**90)** (بَلْ اَتَيْنَاهُمْ بِالْحَقِّ وَاِنَّهُمْ لَكَاذِبُونَ) – **xeyr, biz** (o müşriklərə doğru söz de-yib) **haqq olanı gətirdik.** (Allah-Təalanın şəriki və övladı yoxdur)**. Amma həqiqətən,** (o müşriklər bunu qəbul etməyib Allah-Təalaya şərik qoşmaqda) **yalançıdırlar.**

**91)** (مَا اتَّخَذَ اللّٰهُ مِنْ وَلَدٍ) - **Allah-Təala** (özünə) **övlad götürməyib.** (وَمَا كَانَ مَعَهُ مِنْ اِلٰهٍ اِذًا لَذَهَبَ كُلُّ اِلٰهٍ بِمَا خَلَقَ) – **Onunla birlikdə bir** (iki və s.) **tanrı yoxdur, əgər olsaydı, o zaman hər bir tanrının** (öz məxluqu, öz hakimiyyəti olub)**, o məxluqu alıb gedərdi,** (وَلَعَلَا بَعْضُهُمْ عَلٰى بَعْضٍ) - (dünya padşahları kimi) **bir-biriləri ilə** (mücadilə edib) **qalib gəlməyə çalışardılar.** (Bir halda ki belə bir şey yoxdur, bilin ki, aləmin tək nizamı olduğu üçün bütün aləmlərin idarəçisi yeganə olan Allah-Təaladır). (سُبْحَانَ اللّٰهِ عَمَّا يَصِفُونَ) **- Allah-Təala müşriklərin ona isnad etdiyi xüsusiyyətlərdən** (Ona şərik qoşulmasından) **pak və mü-qəddəsdir.**

عَالِمِ الْغَيْبِ وَالشَّهَادَةِ فَتَعَالٰى عَمَّا يُشْرِكُونَ ﴿٩٢﴾ قُلْ رَبِّ اِمَّا تُرِيَنّ۪ي مَا يُوعَدُونَ ﴿٩٣﴾ رَبِّ فَلَا
تَجْعَلْن۪ي فِي الْقَوْمِ الظَّالِم۪ينَ ﴿٩٤﴾ وَاِنَّا عَلٰٓى اَنْ نُرِيَكَ مَا نَعِدُهُمْ لَقَادِرُونَ ﴿٩٥﴾ اِدْفَعْ بِالَّت۪ي هِيَ
اَحْسَنُ السَّيِّئَةَ نَحْنُ اَعْلَمُ بِمَا يَصِفُونَ ﴿٩٦﴾ وَقُلْ رَبِّ اَعُوذُ بِكَ مِنْ هَمَزَاتِ الشَّيَاط۪ينِ ﴿٩٧﴾

---

**92)** (عَالِمِ الْغَيْبِ وَالشَّهَادَةِ فَتَعَالٰى عَمَّا يُشْرِكُونَ) – **qeybə də, aşkara da agah olan Odur,** (müşriklərin bütlərə sitayiş edib) **Ona şirk qoşmasından da ucadır.**

**93)** (قُلْ رَبِّ اِمَّا تُرِيَنّ۪ي مَا يُوعَدُونَ) - (ey Məhəmməd)**, de ki, ey mənim rəbbim, müşriklərə vəd etdiyin əzabı** (dünyada, ya da axirətdə) **mənə göstərəcəksənsə,**

**94)** (رَبِّ فَلَا تَجْعَلْن۪ي فِي الْقَوْمِ الظَّالِم۪ينَ) – **o zaman ey mənim rəbbim, məni o zalım qövmün içində qoymayıb** (onlarla birlikdə mənə də əzab etmə)**.**

**95)** (وَاِنَّا عَلٰٓى اَنْ نُرِيَكَ مَا نَعِدُهُمْ لَقَادِرُونَ) - (ey Məhəmməd)**, həqiqətən,** (müşriklərə) **vəd etdiyimiz əzabı sənə göstərməyə qadirik.** (Səbəb nədir ki, müşriklər bunu inkar edirlər)**.**

**96)** (اِدْفَعْ بِالَّت۪ي هِيَ اَحْسَنُ السَّيِّئَةَ) - (ey Məhəmməd)**, müşriklərin sənə etdiyi pis** (əzabı) **gözəl şəkildə*** (səbir edib güzəşt etməklə) **özündən dəf et.** (نَحْنُ اَعْلَمُ بِمَا يَصِفُونَ) - (ey Məhəmməd, müşriklərin) **sənə isnad etdiyi** (şairlik və dəlilik vəsflərinə) **biz agahıq.** (Onlara səndən çox cəza verməyə bizim qüdrətimiz var. Sən onlardan üz döndərib onlara cavab vermə)**.**

*(***Qeyd:*** İslam ümməti güzəşt edib bağışlamağı, gərək, bu ayədən öyrənib özlərinə şüar etsin. Pisliyə eyni ilə cavab vermək nəfsin xəbisliyindındir. Amma güzəşt edib bağışlamaq nəfsin kamilliyindəndir. Ərəblərin bəni-Münqər qəbiləsinin əyan-əşrafından olan Qeys ibn Asimin oğlunu öz qardaşı oğlu qətlə yetirdi. Qatili tutub Qeysin hüzuruna gətirdilər. dedi: "Nə pis iş görüb, cavanı qorxudursunuz? Açın onun qollarını", ondan sonra qardaşı oğluna xitab edib dedi: "Nə pis əməl edibsən? Qəbilənin sayını azaldıb, köməkçilərini əskiltdin, get, səni bağışladım." Bu kişi cahiliyyə zamanında yaşayıb, ömrünün sonunda müsəlman oldu. Cahiliyyə zamanında güzəşt edib bağışlamaq ərəblərin arasında məşhur olan bir xüsusiyyət idi. Əfv etməyin ləzzətini bilib, intiqamdan üstün tutardılar. İslam dini ortaya çıxandan sonra şəriətin sahibi olan Hz. Peyğəmbər bu gözəl xüsusiyyəti daha da möhkəmləndirdi. Amma islam ümməti bu yaxşı xüsusiyyəti tərk edib, ən adi və kiçik bir şeydən ötrü də intiqam almağı özlərinə şüar edib, aralarında böyük fəsadlar peyda olur).*

**97)** (وَقُلْ رَبِّ اَعُوذُ بِكَ مِنْ هَمَزَاتِ الشَّيَاط۪ينِ) - (ey Məhəmməd)**, de ki, ey mənim rəbbim, şeytanların** (sənin itaətindən çıxan şəxslərin günaha təhrik etməsindən) **vəsvəsəsindən* sənə pənah aparıram.**

*(***Qeyd:*** Allah-Təalanın Hz. Peyğəmbərə bu dualara əmr etməkdə məqsədi onun öz ümmətinə şeytan və şeytan kimi olan pis, zalım şəxslərdən uzaq olmasını öyrətmək*

وَاَعُوذُ بِكَ رَبِّ اَنْ يَحْضُرُونِ ﴿٩٨﴾ حَتّٰٓى اِذَا جَٓاءَ اَحَدَهُمُ الْمَوْتُ قَالَ رَبِّ ارْجِعُونِۙ ﴿٩٩﴾ لَعَلّٓي
اَعْمَلُ صَالِحًا فِيمَا تَرَكْتُ كَلَّاۜ اِنَّهَا كَلِمَةٌ هُوَ قَٓائِلُهَاۜ وَمِنْ وَرَٓائِهِمْ بَرْزَخٌ اِلٰى يَوْمِ يُبْعَثُونَ ﴿١٠٠﴾
فَاِذَا نُفِخَ فِي الصُّورِ فَلَٓا اَنْسَابَ بَيْنَهُمْ يَوْمَئِذٍ وَلَا يَتَسَٓاءَلُونَ ﴿١٠١﴾ فَمَنْ ثَقُلَتْ مَوَازِينُهُ فَاُو۬لٰٓئِكَ
هُمُ الْمُفْلِحُونَ ﴿١٠٢﴾ وَمَنْ خَفَّتْ مَوَازِينُهُ

---

*üçündür, amma müsəlmanların əksəriyyəti fəsadçı və zalım şəxslərlə yoldaş olub, onlarla oturub-durmağı özlərinə şüar edib, onlara kömək etməyi özlərinə fəxr sayırlar. Nə Qurani-Şərifə, nə də Hz. Peyğəmbərin öyüd-nəsihətlərinə, səhabələrin və hidayətə götürən imamların əməllərinə baxmayıb, özlərini vəhşi ulaq kimi aparırlar. Cəhalət necə də dərmansız bir dərddir. Hansı qövmün arasında cəhalət kök salıbsa, o qövmdən heç kimə bir xeyir gəlməz. İslam ümməti Hz. Peyğəmbərin – “övladlarınıza öyrədin” sözünə əməl etsələr, dünya və axirətdə nicat tapmazlarmı? Çünki insanı ucaldan elmdir. Amma cahillər böcəklərə qoşulub, hətta onlardan da əskik hesab olunurlar).*

**98)** (وَاَعُوذُ بِكَ رَبِّ اَنْ يَحْضُرُونِ) **- ey mənim rəbbim, sənə itaətsiz olanların yanımda olub** (mənimlə danışmasından) **sənə pənah aparıram.**

**99)** (حَتّٰٓى اِذَا جَٓاءَ اَحَدَهُمُ الْمَوْتُ قَالَ رَبِّ ارْجِعُونِ) – (şeytanlar və fəsadçılar həmişə zülm, fəsad içində olurlar)**. O vaxta kimi ki ölüm onlardan birinə gəlib,** (öləcəyini anlayanda peşman olub imana daxil olmaqdan ötrü) **deyər: ey mənim rəbbim, məni** (dünyaya) **qaytar.**

**100)** (لَعَلّٓي اَعْمَلُ صَالِحًا فِيمَا تَرَكْتُ) **- bəlkə, mən** (tərk etdiyim imana daxil olub bu dəfə) **yaxşı əməllər edim.** (كَلَّاۜ اِنَّهَا كَلِمَةٌ هُوَ قَٓائِلُهَا) – (ey Məhəmməd, bu arzunu edən şəxs heç vaxt arzusuna çatmaz)**. O dediyi söz** (boş) **bir sözdür.** (Dünyaya bir də qayıtmayacaqdır)**.** (وَمِنْ وَرَٓائِهِمْ بَرْزَخٌ اِلٰى يَوْمِ يُبْعَثُونَ) **- onların önündə** (qiyamət) **günü dirilib** (haqq-hesab verəcəkləri) **günə qədər bir maneə vardır.** (Qiyamət gününə kimi dirilmələri mümkün deyildir. Dirildikdən sonra da dünyaya qayıtmayıb, əməllərinin cəzasını alacaqlar)**.**

**101)** (فَاِذَا نُفِخَ فِي الصُّورِ فَلَٓا اَنْسَابَ بَيْنَهُمْ يَوْمَئِذٍ وَلَا يَتَسَٓاءَلُونَ) **– o zaman ki,** (məhv olan) **surətlərə ruh üflənib** (hamısı dirildilər)**, o günkü gündə aralarında qohumluq kəsilib,** (ata və övlad, qohum-əqrəba da bir-birini tanımayıb)**, bir-birləri ilə sual-cavab da etməzlər.** (Bu mətləb ilk vaxtlarda qorxu və dəhşətin çoxluğundan olar, amma ola bilər ki, ondan sonra bir-birilərini tanıyıb sual-cavab etsinlər, necə ki başqa ayələrdə buna dəlil var)**.**

**102)** (فَمَنْ ثَقُلَتْ مَوَازِينُهُ فَاُو۬لٰٓئِكَ هُمُ الْمُفْلِحُونَ) **- kimin** (Allah-Təala yanında xeyir əməllərinin) **çəkisi ağır** (qiymətli) **olsa, əlbəttə** (qiyamət günü Allah-Təalanın əzabından) **nicat tapıb** (əbədi nemətlərdən feyz alan) **o olar.**

**103)** (وَمَنْ خَفَّتْ مَوَازِينُهُ) **- kimin ki** (Allah-Təala yanında xeyir əməllərinin) **çəkisi yüngül** (dəyərsiz) **olsa,** (məsələn, riyakarlıq səbəbi ilə xeyir əməl etsə)**,**

فَاُولٰٓئِكَ الَّذ۪ينَ خَسِرُوٓا اَنْفُسَهُمْ ف۪ي جَهَنَّمَ خَالِدُونَۚ ﴿١٠٣﴾ تَلْفَحُ وُجُوهَهُمُ النَّارُ وَهُمْ ف۪يهَا كَالِحُونَ
﴿١٠٤﴾ اَلَمْ تَكُنْ اٰيَات۪ي تُتْلٰى عَلَيْكُمْ فَكُنْتُمْ بِهَا تُكَذِّبُونَ ﴿١٠٥﴾ قَالُوا رَبَّنَا غَلَبَتْ عَلَيْنَا شِقْوَتُنَا
وَكُنَّا قَوْمًا ضَٓالّ۪ينَ ﴿١٠٦﴾ رَبَّنَٓا اَخْرِجْنَا مِنْهَا فَاِنْ عُدْنَا فَاِنَّا ظَالِمُونَ ﴿١٠٧﴾ قَالَ اخْسَؤُا ف۪يهَا
وَلَا تُكَلِّمُونِ ﴿١٠٨﴾ اِنَّهُ كَانَ فَر۪يقٌ مِنْ عِبَاد۪ي يَقُولُونَ رَبَّنَٓا اٰمَنَّا فَاغْفِرْ لَنَا وَارْحَمْنَا وَاَنْتَ خَيْرُ
الرَّاحِم۪ينَۚ ﴿١٠٩﴾ فَاتَّخَذْتُمُوهُمْ سِخْرِيًّا حَتّٰٓى اَنْسَوْكُمْ ذِكْر۪ي وَكُنْتُمْ مِنْهُمْ تَضْحَكُونَ ﴿١١٠﴾

---

(فَاُولٰٓئِكَ الَّذ۪ينَ خَسِرُٓوا اَنْفُسَهُمْ ف۪ي جَهَنَّمَ خَالِدُونَ) – (o əməllərin onlara bir faydası olmayıb), **özlərinə zərər verib, cəhənnəmdə əbədi qalarlar.**

**104)** (تَلْفَحُ وُجُوهَهُمُ النَّارُ وَهُمْ ف۪يهَا كَالِحُونَ) – (cəhənnəm) **odu** (şiddətlə) **üzlərinə vurar** (yandırar, istidən dodaqları açılıb) **dişləri də ağarar,** (necə ki qoyunun başını yandıranda o şəklə daxil olur)**.**

**105)** (اَلَمْ تَكُنْ اٰيَات۪ي تُتْلٰى عَلَيْكُمْ فَكُنْتُمْ بِهَا تُكَذِّبُونَ) **-** (ey Məhəmməd, o vaxt da cəhənnəmdə onlara deyilər:) **bəs mənim ayələrim** (Qurani-Şərifin ayələri) **sizə oxunmurdu?** (Xeyr, oxunurdu. Amma) **siz onları təkzib edib** (qəbul etmirsiniz. Düçar olduğunuz bu əzab da Quranı təkzib etmənizin əzabıdır)**.**

**106)** (قَالُوا رَبَّنَا غَلَبَتْ عَلَيْنَا شِقْوَتُنَا وَكُنَّا قَوْمًا ضَٓالّ۪ينَ) – (cəhənnəm əhli də) **deyər: rəbbimiz,** (xəbis əməllərimizə görə) **zəlilliyimiz bizə qalib olub,** (haqdan uzaq düşüb) **asi bir camaat olduq.**

**107)** (رَبَّنَٓا اَخْرِجْنَا مِنْهَا) **- rəbbimiz, bizi cəhənnəmdən çıxarıb** (dünyaya qaytar)**.** (فَاِنْ عُدْنَا فَاِنَّا ظَالِمُونَ) **- əgər bir də qayıdıb** (kafir olsaq)**, o vaxt da həqiqətən, zalım olarıq.** (Əzaba layiq olarıq)**.**

**108)** (قَالَ اخْسَؤُا ف۪يهَا وَلَا تُكَلِّمُونِ) **-** (hər bir dildə itə acıqlanıb qovanda xüsusi bir ifadə ilə onu qovarlar. Ərəb dilində o söz – “əxsa” sözüdür. Allah-Təala cəhənnəm əhlini susdurmaq üçün itə deyilən sözlə onlara belə xitab edir:) **xar və zəlil olduğunuz halda qalıb danışmayın,** (heç vaxt buradan xilas olan deyilsiniz)**.**

**109)** (اِنَّهُ كَانَ فَر۪يقٌ مِنْ عِبَاد۪ي يَقُولُونَ رَبَّنَٓا اٰمَنَّا فَاغْفِرْ لَنَا وَارْحَمْنَا وَاَنْتَ خَيْرُ الرَّاحِم۪ينَ) **- həqiqətən,** (mömin) **bəndələrimdən bir dəstə var idi.** (Belə) **deyirdilər: ey bizim rəbbimiz, iman gətirdik** (sənə, peyğəmbərinə və Qurana)**, bizi bağışlayıb rəhm et, rəhm edənlərin ən yaxşısı sənsən.**

**110)** (فَاتَّخَذْتُمُوهُمْ سِخْرِيًّا حَتّٰٓى اَنْسَوْكُمْ ذِكْر۪ي) – (ey cəhənnəm əhli)**, siz mənim o bəndələrimə istehza etdiniz. Hətta məni də yadınızdan çıxarıb, unutdunuz.** (Gərək, məndən qorxub mənim bəndələrimə istehza etməyəydiniz)**.** (وَكُنْتُمْ مِنْهُمْ تَضْحَكُونَ) **– onlara** (istehza ilə) **gülürdünüz.** (İndi istəyirsiniz ki, əzabdan

اِنّي جَزَيْتُهُمُ الْيَوْمَ بِمَا صَبَرُوٓاۙ اَنَّهُمْ هُمُ الْفَٓائِزُونَ ﴿١١١﴾ قَالَ كَمْ لَبِثْتُمْ فِي الْاَرْضِ عَدَدَ سِنِينَ
﴿١١٢﴾ قَالُوا لَبِثْنَا يَوْمًا اَوْ بَعْضَ يَوْمٍ فَسْـَٔلِ الْعَٓادّٖينَ ﴿١١٣﴾ قَالَ اِنْ لَبِثْتُمْ اِلَّا قَلٖيلًا لَوْ اَنَّكُمْ كُنْتُمْ
تَعْلَمُونَ ﴿١١٤﴾ اَفَحَسِبْتُمْ اَنَّمَا خَلَقْنَاكُمْ عَبَثًا وَاَنَّكُمْ اِلَيْنَا لَا تُرْجَعُونَ ﴿١١٥﴾ فَتَعَالَى اللّٰهُ الْمَلِكُ
الْحَقُّۚ لَٓا اِلٰهَ اِلَّا هُوَۚ رَبُّ الْعَرْشِ الْكَرٖيمِ ﴿١١٦﴾ وَمَنْ يَدْعُ مَعَ اللّٰهِ اِلٰهًا اٰخَرَۙ لَا بُرْهَانَ لَهُ بِهٖۙ فَاِنَّمَا
حِسَابُهُ عِنْدَ رَبِّهٖۜ اِنَّهُ لَا يُفْلِحُ الْكَافِرُونَ ﴿١١٧﴾

---

xilas olub qurtulasınız? Gərək, bu gündə də möminlər sizə baxıb istehza ilə gülsünlər)**.**

**111)** (اِنّي جَزَيْتُهُمُ الْيَوْمَ بِمَا صَبَرُوا اَنَّهُمْ هُمُ الْفَٓائِزُونَ) **- həqiqətən,** (möminlər dünyada sizin əziyyətlərinizə) **səbir etdiklərinə görə, onlara mükafat verdik** (ki, cənnətə gedib orada əbədi qalıb) **nicat tapsınlar.**

**112)** (قَالَ كَمْ لَبِثْتُمْ فِي الْاَرْضِ عَدَدَ سِنِينَ) – (Allah-Təala qiyamət günündə məhşər əhlinə xitab edib) **deyər: yer üzündə neçə il qalıb** (ömür sürdünüz?)

**113)** (قَالُوا لَبِثْنَا يَوْمًا اَوْ بَعْضَ يَوْمٍ فَسْـَٔلِ الْعَٓادّٖينَ) – (məhşər əhli) **deyər:** (qiyamət gününün qorxusundan yadımızda heç nə qalmayıb. Dünyada) **bir gün, ya da bir gündən bir az qalmışıq.** (İlahi)**, onu saya bilənlərdən** (buna qadir olanlardan) **soruş.** (Bizdə saymağa qüdrət qalmayıb)**.**

**114)** (قَالَ اِنْ لَبِثْتُمْ اِلَّا قَلٖيلًا لَوْ اَنَّكُمْ كُنْتُمْ تَعْلَمُونَ) – (Allah-Təala) **buyurur:** (bəli, elədir, dünyada) **çox az qalıb** (az ömür sürübsünüz, kaş dünya həyatının az olduğunu bildiyiniz halda, qafil olub pis əməllərlə məşğul olmayaydınız)**.**

**115)** (اَفَحَسِبْتُمْ اَنَّمَا خَلَقْنَاكُمْ عَبَثًا وَاَنَّكُمْ اِلَيْنَا لَا تُرْجَعُونَ) **- yoxsa siz elə güman edirsiniz ki, biz sizi boş yerə yaratmışıq və** (dirilib) **bizim tərəfimizə qayıtmayacaqsınız?** (Elə deyil, siz insanlar hikmət üzrə yaradılıb, hamınız bizim tərəfimizə qayıdıb əməllərinizin qarşılığını alacaqsınız)**.**

**116)** (فَتَعَالَى اللّٰهُ الْمَلِكُ الْحَقُّ) – (hər bir şeydən) **uca olan Allah-Təala həqiqi hökmdar olub,** (hər bir şeyə malik olmaq Ona layiqdır)**.** (لَٓا اِلٰهَ اِلَّا هُوَ رَبُّ الْعَرْشِ الْكَرٖيمِ) **– uca ərşin tərbiyə verən rəbbi** (xeyir və bərəkət sahibi yeganə) **Allah-Təaladan başqa heç bir** (haqq) **məbud yoxdur,** (Allah-Təala bütün aləmin taxtına, hakimiyyətinə sahib olduğundan taxta (ərşə) xeyir, bərəkət vəsfini isnad etdi)**.**

**117)** (وَمَنْ يَدْعُ مَعَ اللّٰهِ اِلٰهًا اٰخَرَ لَا بُرْهَانَ لَهُ بِهٖ) **- kim Allah-Təala ilə yanaşı başqa bir məbuda ibadət etsə, hansı ki** (onun Allah-Təalaya şərik qoşmasında) **heç bir dəlil və sübutı yoxdur,** (فَاِنَّمَا حِسَابُهُ عِنْدَ رَبِّهٖ اِنَّهُ لَا يُفْلِحُ الْكَافِرُونَ) **- həqiqətən,** (belə müşrik şəxsin əməlinin cəzası və) **haqq-hesabı öz rəbbi Allah-Təalanın ya-**

وَقُلْ رَبِّ اغْفِرْ وَارْحَمْ وَاَنْتَ خَيْرُ الرَّاحِمِينَ﴿١١٨﴾

---

**nındadır.** (Onun haqq-hesabının nəticəsi budur ki, kafir olduğu üçün nicat tapmayacaqdır)**.**

**118)** (وَقُلْ رَبِّ اغْفِرْ وَارْحَمْ وَاَنْتَ خَيْرُ الرَّاحِمِينَ) **-** (ey Məhəmməd, dua edib belə) **de: "Ey mənim rəbbim, bizi bağışlayıb rəhm et. Rəhm edənlərin ən yaxşısı sənsən."**

Allaha həmd olsun. Muminun surəsinin təfsiri bitdi. Allah-Təala bu surənin əvvəlində və axırında möminlərin nicat tapacağını, kafirlərin isə nicat tapmayacağını bəyan etdi. Bu mübarək surədə edilən xəbərdarlıqlar və təhdidlər öyüd-nəsihət qəbul edən şəxslərə kifayət edib, haqq yol arzusunda olanlara hidayət edəndir. Xüsusən, mübarək surənin əvvəlində və axırında zikr olunan hökmlərə tabe olanlar həqiqət yolunda bərqərar olub dünya və axirət nicatına qovuşarlar. Hz. Peyğəmbər buyurubdur: "Kim bu surəni oxusa, Allah-Təala tərəfindən gələn mələklər o şəxsi axirət nemətlərinə qovuşub rahat olacağı müjdəsini verərlər." Bir başqa hədisdə belə buyurub: "Bu surənin əvvəlində 10 ayə mənə nazil olub ki, kim onlara möhkəm yapışıb əməl etsə, o şəxs cənnətə daxil olar." (Əhməd b. Hənbəl, Müsnəd, I/34, Qazi Beyzavi, Ənvarut-Tənzil, IV/363) Həqiqətən, mübarək surənin əvvəlində vaqe olan ayələrə əməl etmək dünya və axirətin səadətinə baisdir. Xeyirli əməli və gözəl əxlaqı əmr edən ayələrə tabe olmaq insanı ən alçaq olan cahillik dərəcəsindən ən yüksək olan alimlik dərəcəsinə çıxarar. Qurani-Şərifin açıq-aşkar ayələri elmin fəzilət və şərəfinə işarə etməkdə kifayət etməzmi? Amma zahirdə elm əhli, batində cahil və nadan olanlar Qurani-Şərifdə elm barəsində varid olan dərin ayələrdən bixəbər olduqlarından qeyri-müsəlman olan alimlərin elmin şərəfi barəsində Qurani-Şərifdən aldıqları sözləri özlərinə dəlil və sübut sayırlar.



## ən-NUR SURƏSİ

24-cü surədir. Mədinədə nazil olub, 64 ayə, 1366 kəlmə, 5675 hərfdir.



بِسْمِ اللّٰهِ الرَّحْمٰنِ الرَّحِيمِ. سُورَةٌ اَنْزَلْنَاهَا وَفَرَضْنَاهَا وَاَنْزَلْنَا فِيهَآ اٰيَاتٍ بَيِّنَاتٍ لَعَلَّكُمْ تَذَكَّرُونَ ﴿١﴾
اَلزَّانِيَةُ وَالزَّانِي فَاجْلِدُوا كُلَّ وَاحِدٍ مِنْهُمَا مِائَةَ جَلْدَةٍ

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1)** (سُورَةٌ اَنْزَلْنَاهَا وَفَرَضْنَاهَا) **-** (ey Məhəmməd)**, bu, sənə nazil edib,** (ondakı hökmləri) **vacib etdiyimiz bir surədir.** (Gərək, o hökmlər tərk olunmasın. İlahi, sən belə buyurursan, amma biz o hökmlərin bəzisini mübah (savab) sayıb, bəzisini məkruhluqdan (harama yaxın) çıxarıb hökmsüz etmişik. Bu mətləb bundan sonrakı ayələrdə bəyan olunacaq)**.** (وَاَنْزَلْنَا فِيهَا اٰيَاتٍ بَيِّنَاتٍ لَعَلَّكُمْ تَذَكَّرُونَ) – (bu surədə o hökmlərə) **açıq-aydın işarə edən ayələr nazil etdik ki, bəlkə, ibrət alıb düşünəsiniz** (və onlara əməl edəsiniz)**.**

**2)** (اَلزَّانِيَةُ وَالزَّانِي فَاجْلِدُوا كُلَّ وَاحِدٍ مِنْهُمَا مِائَةَ جَلْدَةٍ) – (Allah-Təalanın vacib etdiyi hökmlər bunlardır:) **zinakar qadın və zinakar kişinin hər birinə 100 çubuq vurun.** (Bu 100 çubuq həd cəzası - "zinayi-qeyri-muhsan"ın - subay zinakarların cəzasıdır. Amma evli olan şəxs zina etsə, ona "zinayi-muhsan" deyilir. Onun hökmü başqadır. Subay zinakarların cəzası haqqında imam Şafii və imam Malik belə deyiblər: "100 çubuq, bir il də sürgün edib, başqa yerə göndərmək lazımdır." Şiə imamiyyə üləması da belə deyib, amma saç-saqqalını da qırxıb camaatın içində dolaşdırmağı buna əlavə ediblər. Amma imam Əbu Hənifə sürgün etməyi vacib saymayıb, onu imamın rəyinə həvalə edibdir. Amma evli zinakarın cəzası "rəcm"dir, yəni daşqalaq edilməkdir. Gərək, zinakar ağıllı, həddi-büluğa çatmış, azad, evli olsun, imam Əbu Hənifə müsəlman olmağı da şərt qoşubdur. İmam Şafii və imamiyyə üləması müsəlman olma şərtini qoşmayıb, qeyri-müsəlman da olsa, evli zinakarlara rəcm cəzası veriblər. (Tusi, Təhzib, X/14) Bu cəzalar azad insanların cəzasıdır. Amma qulam, ya da kənizlərin içində zinakar olsa, onların cəzası azad şəxsin cəzasının yarısı qədər – 50 çubuqdur. Onlara rəcm edilməz. Hərçənd ayədə evli, ya da subay şərti olmadan zinakarlara 100 çubuq cəzası verilir, amma Hz. Peyğəmbərin evli zinakarlara verdiyi cəza islam alimlərinin icması ilə də rəcm olubdur. Çünki Allah-Təala Qurani-Şərifdə bizə Hz. Peyğəmbərin hər bir əmr və fərmanına itaət etməyi əmr edib, gərək, bu hökmü də qəbul edib ayədə vaqe olan hökmü subay zinakarlara məxsus edib elə qərar verək, necə ki digər islam üləması da belə

وَلَا تَأْخُذْكُمْ بِهِمَا رَأْفَةٌ فِي دِينِ اللّٰهِ اِنْ كُنْتُمْ تُؤْمِنُونَ بِاللّٰهِ وَالْيَوْمِ الْاٰخِرِ وَلْيَشْهَدْ عَذَابَهُمَا طَٓائِفَةٌ مِنَ الْمُؤْمِنِينَ ﴿٢﴾

---

qərar verib. Amma Tövratda evli zinakarlar barəsində açıq-aşkar rəcm hökmü verilib. Tövratın bu hökmü bizdən ötrü bir başqa dəlildir. Çünki Tövratın Qurani-Şərif tərəfindən "nəsx" edilməyən hər bir hökmü biz müsəlmanlardan ötrü də vacib bir hökmdür. Zina böyük günahlardan hesab olunur. O səbəbdən Allah-Təala Furqan surəsində zinanı adam öldürmə və şirklə birlikdə bir ayədə zikr edib qadağan edir. Hz. peyğəmbər buyurubdur: "Zinadan çəkinin. Zinadan 6 pis şey hasil olar, 3-ü bu dünyada, 3-ü axirətdə. Dünyada olanlar bunlardır: 1-zinakar şəxsin camaat arasında hörməti olmaz. 2-zinayla məşğul olanın var-dövləti puç olub kasıblaşar. 3-az ömür sürər. Hz. Peyğəmbər necə də doğru buyurub, bu 3 xüsusiyyətin 3-ü də zinakar şəxsdə görünübdür. Ey var-dövlət sahibləri, zinakarlıq çox pis şey olub, insanı fəlakətə salar, camaatın qınağına tuş gəlib, ömrü qısalar, çox vaxt nəsli də kəsilər. Bir halda ki, Hz. Peyğəmbər ümmətinin gələcəyini düşünüb, onların mallarının və ömürlərinin azalmasına razı olmayıb, onlara zərər verən şeyləri qadağan edib, belə şəxsin uca fərmanına itaət etməmək insafsızlıqdır. Axirətdə meydana gələn pis şeylər bunlardır: 1-Allah-Təalanın qəzəbi 2-haqq-hesab anında əziyyət çəkmək 3-cəhənnəm odunda daim əzab çəkmək. Zina iki şeylə təsdiq olunar, I zinakarın 4 dəfə iqrar etməsi ilə, əgər 3 dəfə iqrar edib, 4-cü dəfə iqrar etməsə, zina cəzası düşər. II 4 nəfər şahidin şəhadəti ilə təsdiq olunar. Gərək, belə şəhadət edilsin: "Mil sürmə qabına girdiyi kimi, onları da elə əlaqədə gördük". Əgər onların bir yerdə yatmasına, ya da qucaqlaşıb, eyş-işrətlə məşğul olmalarına şəhadət edilsə, bu, zina sayılmayıb, zina cəzası da verilməz. Əgər 3, ya 2 nəfər şahidlik etsə, bununla da zina sayılmaz. Hətta o şahidlərə yalandan məsum bir şəxsə zina isnad etdikləri üçün 80 çubuq cəzası ("həddi-qəzf") verilər. Bu cəza bundan sonra gələn ayədə bəyan olunur. II xəlifə Ömər ibn Xəttab bir dəfə minbərə çıxıb dedi: "Ey peyğəmbərin səhabələri, əgər xəlifə və imam təkcə özü bir kişi və bir arvadın zina etdiklərini görsə, şahidsiz olan xəlifənin onlara həd cəzası verməsi caizdir, yoxsa yox?" Hz. Peyğəmbərin səhabələri hamısı dedi ki, bəli, caizdir. Ömər üzünü Əli ibn Əbu Talibə tutub dedi: "ey Əbül-Həsən, sən danış." O cənab dedi: "Caiz deyildir." Xəlifə olsun, ya da olmasın Allah-Təala zinaya şahidlərin 4-dən əskik olmasına razı deyildir." Xəlifə bunu qəbul edib, camaat da sakit oldu). **(وَلَا تَأْخُذْكُمْ بِهِمَا رَأْفَةٌ فِي دِينِ اللّٰهِ)** – (ey müsəlmanların rəhbərləri, zinakar insanlara rəhm edib) **Allah-Təalanın dini barəsində onlara qəlbiniz yanıb yumşalmasın.** (Onlara rəhm edib az cəza verib, ya da yumşaq vurmayın. Cəzaları verməkdə sabit və bərqərar olun). **(اِنْ كُنْتُمْ تُؤْمِنُونَ بِاللّٰهِ وَالْيَوْمِ الْاٰخِرِ) - Allah-Təalaya və axirət gününə** (cəza gününə) **iman gətiribsinizsə,** (əlbəttə, onlara rəhm etməyib, Allah-Təalanın qoyduğu cəzaları tətbiq edin. Bu ayə müsəlmanların əyan-əşrafının anasını ağladan ayədir). **(وَلْيَشْهَدْ عَذَابَهُمَا طَٓائِفَةٌ مِنَ**

اَلزَّانِي لَا يَنْكِحُ اِلَّا زَانِيَةً اَوْ مُشْرِكَةًۘ وَالزَّانِيَةُ لَا يَنْكِحُهَآ اِلَّا زَانٍ اَوْ مُشْرِكٌۚ وَحُرِّمَ ذٰلِكَ عَلَى الْمُؤْمِنِينَ ﴿٣﴾ وَالَّذِينَ يَرْمُونَ الْمُحْصَنَاتِ

---

(الْمُؤْمِنِينَ) – (zinakarlara cəza veriləndə) **möminlərdən bir dəstə onların əzabına şahid olsun,** (ki, onlar da zəlil və xəcil olub, sair insanlar da bundan ibrət alsınlar. Cəza veriləndə də gərək, 3 nəfərdən əskik şahid olmasın, əgər zinakara xəlvətdə, şahidsiz yerdə cəza verilsə, o cəza kifayət etməyib, gərək yenidən camaat hüzurunda ona cəza verilsin. Kişiyə cəza verəndə libası çıxarılıb, ancaq ayıb yerləri örtülü halda ayaq üstündə həd cəzası verilər. Amma qadına həd cəzası veriləndə, əgər əynində qalın libas, kürk, ya da içi pambıqla, yunla dolu libas olsa, onlar çıxarılar. Nazik libasla, oturduğu yerdə ona həd cəzası verilər. Belə bir uca hökmü müsəlmanlar necə tərk edib, çox təəccüblüdür)**.**

**3)** (اَلزَّانِي لَا يَنْكِحُ اِلَّا زَانِيَةً اَوْ مُشْرِكَةً) **- zinakar,** (fasiq və xəbis) **kişi** (saleh qadınlarla yox*) **ancaq özü kimi bir zinakar** (fasiq və xəbis) **qadınla, ya da müşrik bir qadınla evlənə bilər,** (bu kəlamın bu dövrdə zahir olması Qurani-Şərifin haqlılığına işarə edir)**.** (وَالزَّانِيَةُ لَا يَنْكِحُهَا اِلَّا زَانٍ اَوْ مُشْرِكٌ) **- habelə zinakar** (fasiq və xəbis) **qadınla da** (saleh və mömin şəxslər yox)**, ancaq** (özləri kimi fasiq və xəbis) **zinakar, ya da müşrik bir kişi evlənər.** (Halbuki evlilik üçün gərək saleh qadınlara rəğbət edilsin ki, onların pak rəhmlərindən də pak övladlar dünyaya gəlsin)**.**

*(*Qeyd:* ***Qeyd:*** *Bu mətləb əsl bizim bu zəmanəmizə uyğundur. Var-dövlət sahibi müsəlmanlar o nemətə görə Allaha şükür etmək əvəzinə pak və halal müsəlman qadınlarla evlənməyi tərk edib, ya da nikahlı arvadlarını tərk edib, digər kişilərin artığı olan xəbis, zinakar qadınlara bənd olub, həm canlarını, həm də mallarını o cür xəbis qadınlarla eyş-işrət yolunda tələf edirlər. Bu səbəbdən hər cür xəstəliklərə də düçar olduqlarından cavan çağlarında qiymətli ömürləri puç olub, söyüş və lənətdən başqa, bir şey də qazanmayıb miras qoymurlar).*

(وَحُرِّمَ ذٰلِكَ عَلَى الْمُؤْمِنِينَ) – **bu** (zinakar qadınlarla evlənmək) **mömin şəxslərə haram edildi.** (Gərək, zinakar qadınla evlənməkdən çəkinsinlər. Ayədən belə məlum olur ki, zinakarlarla evlənənlər müsəlmanlıqdan çıxmış olurlar. İmamiyyə üləmasının əksəriyyəti belə bir zahir və aşkar hökmün zahiri mənasını tərk edib, ancaq məkruh sayıb deyiblər: zinakar arvadı almaq məkruhdur. Allah qorusun, bunun səbəbi nədir ki, ayədə vaqe olan haram sözünü məkruh mənasına yozurlar? Ola bilər ki, bu barədə varid olan vahid xəbəri (zəif hədisi) qəbul edib Qurani-Kərimin aşkar olan hökmünü tərk ediblər. Özləri Quran ehkamını təhrif edib dəyişdirdiklərindən qafil olub, yəhudilərə Tövrat hökmünü dəyişdirdikləri üçün tənə edirlər)**.**

ثُمَّ لَمْ يَأْتُوا بِاَرْبَعَةِ شُهَدَٓاءَ فَاجْلِدُوهُمْ ثَمَانِينَ جَلْدَةً وَلَا تَقْبَلُوا لَهُمْ شَهَادَةً اَبَدًاۚ وَاُو۬لٰٓئِكَ هُمُ الْفَاسِقُونَۙ ﴿٤﴾ اِلَّا الَّذ۪ينَ تَابُوا مِنْ بَعْدِ ذٰلِكَ وَاَصْلَحُواۚ فَاِنَّ اللّٰهَ غَفُورٌ رَح۪يمٌ ﴿٥﴾

---

**4)** (وَالَّذ۪ينَ يَرْمُونَ الْمُحْصَنَاتِ) – (bu ayədə həddi-qəzfin hökmü bəyan olunur)**. O şəxslər ki, ismətli** (və saleh) **qadınlara zina isnad edirlər,** (məsələn, onlara desələr ki, ey zinakar, ya da sən zina edibsən, ya da filankəs zinakardır. Bir kəsə zina isnad edəndə 4 nəfər şahid lazımdır ki, onun zinası təsdiq olunsun)**,** (ثُمَّ لَمْ يَأْتُوا بِاَرْبَعَةِ شُهَدَٓاءَ) – (ismətli qadınlara zina isnad edəndən) **sonra** (bunu sübut etmək üçün) **4 şahid gətirməsələr,** (o vaxt o şəxslərə həd cəzası vermək lazımdır, çünki saleh qadına zina isnad ediblər)**.** (فَاجْلِدُوهُمْ ثَمَانِينَ جَلْدَةً) – (saleh qadınlara zina isnad edənlərə) **80 çubuq vurun.** (وَلَا تَقْبَلُوا لَهُمْ شَهَادَةً اَبَدًا) – (onlara həd cəzası verəndən sonra) **heç vaxt onların şəhadətini qəbul etməyin,** (وَاُو۬لٰٓئِكَ هُمُ الْفَاسِقُونَ) – (saleh qadınlara zina isnad etdikləri üçün) **onlar fasiqdirlər.**

**5)** (اِلَّا الَّذ۪ينَ تَابُوا مِنْ بَعْدِ ذٰلِكَ وَاَصْلَحُواۚ فَاِنَّ اللّٰهَ غَفُورٌ رَح۪يمٌ) – (fasiq qaldıqları müddətcə onların şəhadəti qəbul olunmaz, ancaq hədd cəzası veriləndən) **sonra tövbə edib** (dedikləri sözləri) **islah edib** (yaxşı sözlər danışsalar)**, o vaxt, həqiqətən, Allah-Təala onlara rəhm edib günahlarını bağışlayandır.** (Bu ayədə zikr olunan həddə həddi-qəzf deyilir, yəni kişi, qadın fərqi olmadan bir insana zina, homoseksuallıq, adam döymə, masturbasiya, qucaqlaşma, məşuqluq, məşuqəlik kimi xəbis əməllər isnad etməyə "qəzf" (iftira) deyilir. Amma bu ayədə "qəzf"dən məqsəd zina isnadıdır. Zina hökmünün dalınca bu hökmün zikr olunması bu mətləbə şahiddir. İslam alimləri arasında bu məsələdə ixtilaf vardır: bir şəxsə həddi-qəzf tətbiq edilsə, ondan sonra da o şəxs tövbə etsə, onun şəhadəti qəbul olunar, yoxsa yox? Bu ayə tövbənin qəbul olunduğuna işarədir. İmam Şafii və imamiyyə üləması Qurani-Şərifə müvafiq fitva verib tövbənin qəbul olunduğunu deyiblər. İmam Əbu Cəfər Məhəmməd Bağır və Əbu Abdullah Cəfər Sadiq də tövbənin qəbul olunduğunu deyiblər. II xəlifə Ömər ibn Xəttabın zamanında Müğirə ibn Şubə Bəsrədə vali olarkən Həccac ibn Atiqin arvadı Ümmü Cəmillə zina etdi. Onun otağının qarşısındakı otaqda olan 4 qardaş - 1-Əbu Bəkir 2-Ziyad 3-Nafi 4-Şibl (Sümeyyənin oğulları-hər biri ayrı atadan idi) Müğirəni zina edərkən gördülər. Bu əhvalatı gəlib xəlifəyə bildirdilər. Xəlifə Müğirəni və şahidləri Mədinəyə çağırdı. 3 qardaş (Əbu Bəkir, Nafi, Şibl) zinaya şəhadət etdilər, amma Ziyad şəhadət etmədi. Səbəbi də bu idi ki, Ziyad o vaxt orada deyildi. Xəlifə gəlib məsciddə mühacir, ənsarla əyləşib Ziyadı çağırtdırdı. Ziyad gələndə Müğirə gedib ona dedi: "Ey Ziyad, qiyamət günündən qorxub məni rüsvay etmə. Məni Ümmü Cəmilin qarnının üstündə görmək səni şəhadət etməyə vadar etməsin. Əgər sən mənim qarnımla Ümmü Cəmilin qarnının arasında olaydın, yenə də mənim alətimin onun içinə daxil

olduğunu görə bilməzdin. Sən buna necə şəhadət edərsən?” Ondan sonra xəlifənin hüzuruna gəldi. Xəlifə Ziyadı görəndə dedi: “Elə bir kişinin gəldiyini görürəm ki, Allah-Təala bir mühaciri (yəni Müğirəni) onun dili ilə zəlil etməz, ondan sonra Ziyad zinaya şəhadət etməyib belə dedi: “Mən Müğirə və Ümmü Cəmili hər ikisini bir yerdə gördüm, Müğirənin beldən aşağı hissəsi yuxarı qalxıb, özü də yüksək səslə nəfəs alırdı. Ümmü Cəmilin iki ayaqları eşşəyin iki qulağı kimi havaya qalxmışdı. Müğirənin xayaları Ümmü Cəmilin iki budunun arasında hərəkət edirdi.” Ömər dedi: “Necə ki mil sürmə qabına girib-çıxır, onların alətlərini də o şəkildə gördünmü?” Ziyad dedi: “Görmədim.” Ömər dedi: “Allahu əkbər”, ondan sonra əmr etdi: o 3 nəfərə həddi-qəzf tətbiq etdilər, Əbu Bəkir peyğəmbərin səhabələrindən və mötəbər şəxs olduğundan xəlifə ona tövbə etməyi əmr etdi. Əbu Bəkir dedi: “Mənə tövbə etməyi əmr etməkdə məqsədin bundan sonra şəhadətim qəbul olunması üçündür?” Xəlifə dedi: “Bəli, elədir.” Əbu Bəkir dedi: “Mən əhd edirəm ki, bundan sonra şəhadət etməyim və indi də şəhadət edirəm ki, Müğirə zina etdi.” Ömər istədi ki, Əbu Bəkirə ikinci dəfə həddi-qəzf tətbiq etsin. Əli ibn Əbu Talib də o məclisdə idi. Ömərə xitab edib dedi: “Əgər sən Əbu Bəkirə yenidən həddi-qəzf tətbiq etsən, mən də sənin yoldaşın Müğirəyə zina cəzası verəcəyəm.” Ömər sakitləşib Əbu Bəkirdən əl çəkdi. Ondan sonra Ömər həcdən ötrü Məkkəyə gedib orada Ümmü Cəmili görüb tanıdı. (Ümmü Cəmil  məşhur bir qadın olduğundan Ömər onu tanıyırdı). Müğirə də xəlifənin yanında idi. Üzünü Müğirəyə tutub dedi: “Bu arvadı tanıyırsanmı?” Müğirə dedi: “Bəli, Əlinin qızı Ümmü Külsümdür.” Xəlifə dedi: “Özünü bilməməzliyə qoyubsan, vallah mən zənn etmirəm ki, Əbu Bəkir sənə yalan isnad etsin. Hər dəfə səni görəndə qorxuram ki, Allah-Təala səmadan mənə bir daş göndərib məni həlak etsin.” Bu qissə İbn Xəllikanın “Vəfəyatül-iyan” adlı tarix əsərindən müxtəsər şəkildə nəql olundu. Bu qissədən məlum olur ki, Əbu Bəkirin tövbəyə əmr edilməsi həddi-qəzfdən sonra tövbə edənin şəhadətinin qəbul olunacağına işarədir. İmam Əbu Hənifə belə şəxsin şəhadətinin qəbul olunmamasına fitva veribdir. Həddən sonra tövbə etsin, ya etməsin, onun şəhadəti qəbul olunmaz, deyibdir. Amma kafir küfr içində ola-ola belə iftira etsə, sonra da müsəlman olub tövbə etsə, Əbu Hənifə və digər fəqihlər o şəxsin şəhadətinin qəbul olunmasına fitva veriblər. İmam Əbu Hənifənin bu fitvası çox təəccüblüdür. İmam Əbu Hənifə hərçənd fiqh elmində dərin elm sahibi idi, (amma bəzən cins at da səhv edər), bəzi məntiqsiz fitvalar veribdir. İbn Xəllikan “Vəfəyatül-`əyan”da sultan Mahmud Qəznəvinin bioqrafiyasında Əbu Hənifədən namaz barəsində bir fətva nəql edib, hərçənd ibn Xəllikan mötəbər bir tarixçidir, amma mən həqir onun imam Əbu Hənifəyə belə fitva isnad etməsini onun qəbahəti sayıb susuram. Kim o fitvaya agah olmaq istəsə, o kitaba baxsın. O fətvanı burda nəql etmək Əbu Hənifəyə irad sayılacağı üçün mən həqir onu qeyd etməkdən vaz keçdim. Amma Əbu Hənifənin bu məsələ ilə əlaqəli onun fəzilət və kamilliyinə işarə edən bir qissəsi var, onu

burada zikr etmək faydalıdır. Əbu Hənifə ilk dövrlərdə Kufədə bir guşə seçib, orada şəriət ehkamından sualı olanlara fitva verirdi. O zaman Kufənin qazısı Məhəmməd ibn Əbu Leyla adlı məşhur bir fəqih idi. Hökm verdiyi zamanlar Kufənin məscidində oturardı. Bir gün məhkəmədən çıxıb evinə gedərkən yolda bir qadının bir kişini söyüb - ey iki zinakarın oğlu, dediyini gördü. Qazı əmr etdi o qadını tutdular. Məscidə geri qayıdıb hökm verdi ki, məsciddə o qadına ayaq üstündə iki həddi-qəzf (yəni 160 çubuq) vursunlar. Bu mətləb Əbu Hənifəyə məlum oldu. Dedi: "Qazı bu hadisədə 6 yerdə xəta edib. 1-məhkəmədən gedəndən sonra dərhal ora geri qayıtması. 2- məsciddə həddi-qəzf tətbiq etmək, halbuki Hz. Peyğəmbər məsciddə "hədd" tətbiq etməyi qadağan edib. 3-qadına ayaq üstündə hədd tətbiq etmək, qadınlara, gərək, oturduğu yerdə paltarlı halda cəza verilsin. 4-bir söyüşə görə iki hədd tətbiq etmək, əgər bir neçə nəfərə də bir dəfə söyüş söyülsə, (məsələn, 5 nəfərə bir dəfə, ey zinakarlar, deyilsə), o söyüşdən ötrü o şəxsə bir həddi-qəzf tətbiq edilər. Hərçənd o qadın o şəxsin ata və anasının hər ikisinə zina isnad edibdir, amma bir kəlmə ilə söydüyü üçün, ona bir həddi-qəzf tətbiq etmək lazım idi. (İmamiyyə üləmasına görə əgər o camaat hamısı birlikdə həddi-qəzf tətbiq edilməsini istəsələr, o şəxsə bir dəfə cəza verilər, amma insanlar tək-tək gəlib həddi-qəzf tətbiq edilməsini istəsələr, hər birindən ötrü bir həddi-qəzf lazımdır). 5-əgər bir şəxsə iki dəfə hədd tətbiq edilməsi lazımdırsa, hər iki həddin arasında vaxt qoymaq lazımdır ki, onun ağrısı azalıb, yarası da sağalsın. Ondan sonra ikinci hədd tətbiq edilsin. Qazı iki həddi bir-birinin üstündən etməklə xəta edibdir. 6- həddi-qəzf tələb edilməmiş qazının onu tutub hədd tətbiq etməsi caiz deyil." Əbu Hənifənin bu sözləri qazıya çatdı. Qazı onun tənqidindən qəzəblənib gedib valiyə şikayət edib dedi: "Kufədə Əbu Hənifə adında cavan bir şəxs var, mənim hökmlərimə qarşı çıxıb, mənim əksimə fitva verir, mənə tənə edib, xəta isnad edir. Xahiş edirəm, onun fitva verməsini qadağan edəsiniz." Vali Əbu Hənifəyə hökm göndərib ona fitva verməyi qadağan etdi. Bir gün Əbu Hənifə özü, arvadı, qızı, bir də oğlu Həmmad oturmuşdular. Qızı atasına sual verib dedi: "Mən orucam, dişlərimin arasından qan çıxdı, ağzımın suyunu o qədər yerə tökdüm ki, qan qalmadı, indi ağzımın suyunu udsam, orucum batil olar, yoxsa yox?" Əbu Hənifə dedi: "Qızım, əmir mənə fitva verməyi qadağan edib. Qardaşın Həmmaddan soruş." Həqiqətən, bu, imam Əbu Hənifədən ötrü nə böyük fəzilətdir? Qurani-Şərifin əmrinə itaət edib zahir və batində möminlərin əmirinə itaət etdi. İslam dininin rəvac tapıb, islam ümmətinin bütün yer kürəsində yayılmasına həmin itaət və ittifaq səbəb oldu. Zamanla islam ümməti arasında nifaq peyda olub ayənin mənası təhrif olundu. Əmirlər günah işlərə bulaşıb, xalq da onlara qarşı çıxdı. Bu səbəbdən islam ümməti günbəgün tənəzzül edib, az qala bəni-İsrail kimi hər yerdə zəlil və xar olublar. Hərçənd bu mövzu uzun sürdü, amma faydasız da deyildir. Qayıdaq əsl mətləbə (ayəyə), hərçənd burada söhbət arvadlara iftira etmək haqqındadır, amma kişilərə də iftira edib zina, ya da homoseksuallıq

وَالَّذِينَ يَرْمُونَ اَزْوَاجَهُمْ وَلَمْ يَكُنْ لَهُمْ شُهَدَآءُ اِلَّآ اَنْفُسُهُمْ فَشَهَادَةُ اَحَدِهِمْ اَرْبَعُ شَهَادَاتٍ بِاللّٰهِ اِنَّهُ
لَمِنَ الصَّادِقِينَ ﴿٦﴾ وَالْخَامِسَةُ اَنَّ لَعْنَتَ اللّٰهِ عَلَيْهِ اِنْ كَانَ مِنَ الْكَاذِبِينَ ﴿٧﴾

---

isnad etməyin də cəzası elədir. Elə ki zikr olunan "qəzf" ayəsi nazil oldu, Hz. Peyğəmbər minbərdə bu ayəni camaata oxudu, Asim ibn Ədi Ənsari ayağa durub dedi: "Ey peyğəmbər, Allah-Təala məni sənə fəda etsin, bir kişi öz arvadıyla bir başqa kişini zina halətində görsə, əgər gəlib xəbər versə, özü fasiq və şəhadəti rədd olunub ona 80 qamçı vurulacaqdır. Ya əgər onu öldürsə, siz də onun əvəzində o şəxsi öldürəcəksiniz. Ya əgər sakit olub dursa, bu da çətindir. Ya da əgər gedib 4 nəfər şahid gətirsə, o kişi işini bitirib gedəcəkdir." Ondan sonra Asim dua edib dedi: "İlahi, bizdən ötrü bu mətləbi aşkar et." Məsciddən çıxıb getdi. Hilal ibn Ümeyyə onunla qarşılaşdı, Asim dedi: "Nə xəbər var?" Hilal dedi: "Çox pis xəbər var. Arvadım Xavlənin qarnının üstündə Şərik ibn Səhmanı zina halətində gördüm. (Hilalın arvadı Xavlə həmin Asimin qızıydı). Asim bunu eşidən kimi dedi: "Vallah, mən də bundan qorxurdum, qorxduğum şeyə nə tez düçar oldum." Gedib Hz. Peyğəmbərə bəyan etdilər. Xavləni ora çağırsalar da, Xavlə bu məsələni inkar etdi. Dedi: "Mənim ərim Hilal özü Şəriki evinə qonaq gətiribdir. İndi bilmirəm, qeyrətdən, yoxsa xəsislikdən bu qəbih əməli mənə isnad edir." Hilal dedi: "Bunlar boş sözlərdir. Mən Şəriki Xavlənin qarnının üstündə gördüm." Hz. peyğəmbər istədi Hilala həddi-qəzf tətbiq etsin. Bundan sonra gələn ayə lənətləşmə barəsində nazil oldu. Yəni ər və arvadın bir-birinə lənət etməsi məsələsi belədir: əgər bir şəxs öz arvadına zina isnad etsə, 4 nəfər şahidi olmasa, onları götürüb məsciddə minbər və mehrabın yanında saxlayarlar. Əvvəlcə ər 4 dəfə şəhadət edər ki, mən bu sözümdə doğru deyənlərdənəm. 5-ci dəfə deyər: əgər yalan deyənlərdənəmsə, Allah-Təalanın lənəti mənim üzərimə olsun, ondan sonra arvad 4 dəfə and içib şəhadət edib belə deyər: mənim ərim yalan deyənlərdəndir. 5-ci dəfə deyər: əgər mənim ərim doğru deyənlərdəndirsə, Allah-Təalanın qəzəbi mənim üzərimə olsun. Bu şəkildə lənətləşib qurtarandan sonra onların nikahı pozulub, o arvad o kişiyə həmişəlik haram olar. Onu yenidən özünə arvad etmək istəsə, caiz deyildir. Əgər o halda uşaq doğsa, uşaq da anasına aid sayılar. İndi bu 4 lənətləşmə ayəsi zikr olunur)**.**

**6)** (وَالَّذِينَ يَرْمُونَ اَزْوَاجَهُمْ وَلَمْ يَكُنْ لَهُمْ شُهَدَآءُ اِلَّا اَنْفُسُهُمْ) **- o şəxslər ki, öz arvadlarına zina isnad edib, amma onlardan ötrü özlərindən başqa heç bir şahid olmasın,** (فَشَهَادَةُ اَحَدِهِمْ اَرْبَعُ شَهَادَاتٍ بِاللّٰهِ اِنَّهُ لَمِنَ الصَّادِقِينَ) – (o kişilərin) **hər biri** (arvadına zina isnad edəndə)**, gərək 4 dəfə and içib şəhadət etsin ki, doğru deyənlərdəndir.** (Şəhadət etmək bu şəkildə olur, kişi, gərək, desin ki, Allah-Təalanın adı ilə şəhadət edirəm ki, arvadıma zina isnad etməkdə doğru deyənlərdənəm)**.**

وَيَدْرَؤُا عَنْهَا الْعَذَابَ اَنْ تَشْهَدَ اَرْبَعَ شَهَادَاتٍ بِاللّٰهِ اِنَّهُ لَمِنَ الْكَاذِبِينَ ﴿٨﴾ وَالْخَامِسَةَ اَنَّ غَضَبَ اللّٰهِ
عَلَيْهَآ اِنْ كَانَ مِنَ الصَّادِقِينَ ﴿٩﴾ وَلَوْلَا فَضْلُ اللّٰهِ عَلَيْكُمْ وَرَحْمَتُهُ وَاَنَّ اللّٰهَ تَوَّابٌ حَكِيمٌ ﴿١٠﴾

---

**7)** (وَالْخَامِسَةُ اَنَّ لَعْنَتَ اللّٰهِ عَلَيْهِ اِنْ كَانَ مِنَ الْكَاذِبِينَ) **- Beşinci dəfə** (belə deyər:) **əgər özü yalan deyənlərdəndirsə, Allah-Təalanın lənəti öz üzərinə olsun.**

**8)** (وَيَدْرَؤُا عَنْهَا الْعَذَابَ اَنْ تَشْهَدَ اَرْبَعَ شَهَادَاتٍ بِاللّٰهِ اِنَّهُ لَمِنَ الْكَاذِبِينَ) **-** (ər arvadın zina etdiyinə dair qeyd olunan kimi, şəhadət etdikdə əgər arvad sükut etsə, ya da iqrar etsə, o vaxt arvada həddi-qəzf tətbiq edilər. Amma əgər cəzadan xilas olmaq istəsə, gərək, o da ərinin yalançı olduğuna dair 4 dəfə şəhadət etsin. Necə ki buyurur:) **qadının da ərinin yalançılardan olması barədə 4 dəfə Allaha şəhadət etməsi əzabı ondan dəf edər,** (şəhadət gərək bu şəkildə olsun, qadın belə deyər: "Allah-Təalaya şəhadət edirəm ki, ərim mənə zina isnad etməkdə yalançılardandır")**.**

**9)** (وَالْخَامِسَةَ اَنَّ غَضَبَ اللّٰهِ عَلَيْهَا اِنْ كَانَ مِنَ الصَّادِقِينَ) **- Beşinci dəfə** (arvad şəhadət edib deyər:) **əgər ərim doğru deyənlərdəndirsə, Allah-Təalanın qəzəbi mənim üzərimə olsun.**

**10)** (وَلَوْلَا فَضْلُ اللّٰهِ عَلَيْكُمْ وَرَحْمَتُهُ) **- əgər Allah-Təalanın sizə lütf və rəhməti olmasaydı,** (hər halda, sizə tezliklə əzab göndərərdi. Lakin Allah-Təala sizin qəbih əməllərinizə pərdə çəkib lənətləşmə səbəbinə həddi-qəzfi sizdən dəf etdi)**.** (وَاَنَّ اللّٰهَ تَوَّابٌ حَكِيمٌ) **- həqiqətən, Allah-Təala tövbə edənlərin tövbəsini qəbul edəndir. Hikmət üzrə** (hər cəzaya öz cəzasını verər. Elə ki, lənətləşmə xüsusunda bu ayələr nazil oldu, Hz. Peyğəmbər Hilal və onun arvadı Xavlə arasında lənətləşmə hökmünü tətbiq edib hər ikisini müvafiq şəkildə şəhadət etdirdi. Hz. Peyğəmbər onların bir-birilərindən boşanmasına və uşaq olarsa, o uşağın Hilala aid olmayacağına hökm etdi. Hz. Peyğəmbər bir səfərə, ya da bir savaşa gedəndə arvadlarının arasında püşk atardı, püşk hansına düşsəydi, onu özü ilə aparardı. Bəni-Müstəliq savaşına gedəndə püşk Aişəyə düşdü. Aişəni özü ilə apardı. O savaşdan qayıdıb Mədinəyə gələndə Mədinənin yaxınlığında bir yerdə dayandılar. O vaxt Aişənin yaşı az olduğundan çəkisi də yüngül olub, kəcavənin içində onu dəvənin üstünə qoyub endirirdilər. O gecə orada qalıb sübh olmamış yola düşmə əmri verildi. Aişə bir ehtiyacdan  ötrü qoşundan ayrılıb geri gələndən sonra kəcavəyə daxil olmaq istədi. Yolda boyunbağısını itirdiyini gördü, geri qayıdıb onu axtararkən Aişənin kəcavəsini götürüb dəvənin üstünə qoydular. Aişənin çəkisi yüngül olduğundan kəcavənin içində olub olmadığına diqqət etməyib yola düşdülər. Aişə boyunbağısını tapıb gələndə, camaatın getdiyini gördü. Aişə, bəlkə, onun dalınca gələrlər deyə orada oturub qaldı. Elə orada da yuxuladı. Səfvan ibn Müəttəl Səhmi qoşunun arxa dəstələrindən  məsul idi. Ordudan bir şəxs, ya da bir əşya düşüb qalsaydı,

onu orduya çatdırmaqla vəzifəli idi. Elə ki sübh açıldı, Səfvan qoşunun arxasında bir qaraltı gördü, gedib gördü ki, kimsə yatıb. Səsləndi ki, ey yatan! Aişə yuxudan oyandı, Səfvan da Aişənin səsindən onu tanıdı. (O vaxtda hicab ayəsi nazil olmuşdu və hicab nazil olmadan əvvəl Səfvan Aişəni görmüşdü). Səfvan Aişəni görən kimi: "Biz Allaha aidik, Ona da dönəcəyik" dedi. Səfvan Aişə ilə bir kəlmə danışmayıb dəvəsini oturtdu, Aişə də gəlib dəvəyə mindi. Səfvan dəvənin cilovundan tutub günorta vaxtı gəlib qoşun əhlinə çatdı. Qoşun əhli Aişəni bu halda görəndə, münafiqlərin əlinə bir bəhanə keçib, Aişəyə iftira etməyə başladılar. O şəkildə gəlib Mədinəyə varid oldular. Aişənin əhvalatı camaatın dilinə düşdü. Ona ilk iftira edən münafiqlərin başçısı olan Abdullah İbn Übeyy idi. Ondan sonra Zeyd ibn Rəfia, şair Həssan ibn Sabit, Əbu Bəkirin xalası nəvəsi Mistah ibn Üsasə və arvadlardan Həmnə Cəhş qızı, başqa şəxslər də bunlara tabe olub iftira etməyə başladılar. Aişə Mədinəyə gələndən sonra xəstələndi, bu sözlərdən xəbərsiz idi. Ancaq Hz. Peyğəmbəri özünə qarşı laqeyd görürdü. Hərdən gəlib qapıda durub deyirdi: "Xəstəniz necədir?" Aişə bu xəstəlikdən çox zəiflədi. Mistah ibn Üsasənin anası (Əbu Bəkirin xalası qızı) Aişəyə xidmət edirdi. Bir dəfə evdən çıxıb geri qayıdanda ayağı libasına ilişib yerə yıxıldı. Ayağa durub dedi: "Lənət olsun Mistaha", Aişə dedi: "Nə pis söz dedin? Bir kişi ki, Bədir savaşında vuruşub, ona lənət edirsən." Qadın dedi: "Məgər eşitməyibsən ki, Mistah sənin haqqında nə deyir? Sənə belə iftiralar atır." Əhvalatı Aişəyə nəql etdi. Aişənin xəstəliyi daha da artdı. Hz. Peyğəmbər Aişənin əhvalını soruşmağa gələndə, Aişə Hz. Peyğəmbərdən izin alıb ata-anasının yanına getdi ki, bu əhvalatdan tam xəbərdar olsun. Atasının evinə gedib anasından bunu soruşdu. Anası dedi: "Qızım, səbir edib, qüssələnmə, hansı ərin yanında belə xoşsifət, gözəl üzlü, sevimli arvad olub, onun günüləri olsa, ondan ötrü belə sözlər deyərlər. Belə ki, onu ərinin gözündən salıb ərini ondan soyutsunlar." Aişə başladı ağlamağa, Hz. Peyğəmbər bu işə çaşqın qalıb bilmədi, nə etsin. Əli ibn Əbu Talibi və Üsamə ibn Zeydi çağırıb onlarla məşvərət etdi. Üsamə dedi: ya peyğəmbər, Aişə hər bir eyibdən pak və müqəddəsdir, mən onun haqqında xeyirdən başqa bir şey bilmirəm", amma Əli ibn Əbu Talib belə dedi: "Ey peyğəmbər, Allah-Təala sənə darlıq verməyib ki, Aişədən başqa da arvadlar çoxdur, Aişə məgər sənin nəleyninin bir bağıdır, niyə özünə sıxıntı verirsən? Ümmü Eymən Bərirədən soruş, həqiqəti sənə bəyan etsin." Hz. Peyğəmbər Bəriranı çağırıb dedi: "Ey Bərirə, Aişədə səni şəkkə salan bir şey görübsənmi?" Bərirə dedi: "Səni haqq peyğəmbər olaraq göndərən Allah-Təalaya and olsun ki, mən Aişədə heç bir şübhəli şey görməmişəm. Ancaq bir şey var ki, yaşı azdır, evdə xəmir yoğrulanda ona deyərik ki, xəmirə diqqət et. Amma onu yuxu tutub, yatar. Keçilər gəlib xəmiri yeyərlər." (Bərirə işarə edir ki, səfərdə də gecə vaxtı onu yuxu tutub yatıbdır və xalqın onun haqqında dediyi sözlərin heç biri ona layiq deyil). Ondan sonra Hz. Peyğəmbər Əbu Bəkirin evinə Aişənin yanına

إِنَّ الَّذِينَ جَآؤُ بِالْاِفْكِ عُصْبَةٌ مِنْكُمْ ۜ لَا تَحْسَبُوهُ شَرًّا لَكُمْ ۜ بَلْ هُوَ خَيْرٌ لَكُمْ ۜ لِكُلِّ امْرِئٍ مِنْهُمْ مَا اكْتَسَبَ مِنَ الْاِثْمِ وَالَّذِي تَوَلّٰى كِبْرَهُ مِنْهُمْ لَهُ عَذَابٌ عَظِيمٌ ﴿١١﴾ لَوْلَآ اِذْ سَمِعْتُمُوهُ ظَنَّ الْمُؤْمِنُونَ وَالْمُؤْمِنَاتُ بِاَنْفُسِهِمْ خَيْرًاۙ وَقَالُوا هٰذَآ اِفْكٌ مُبِينٌ ﴿١٢﴾

---

gedib buyurdu: "Ey Aişə, sənin haqqında mənə bu cür sözlər deyilib, əgər o sözlərdən pak və qüsursuzsansa, Allah-Təala da sənin pak olmağına şəhadət edəcəkdir. Amma əgər qəbih, günah bir əməl edibsənsə, Allah-Təaladan bağışlanma diləyib tövbə et. Günahkar öz günahını iqrar edib tövbə etsə, Allah-Təala da onun tövbəsini qəbul edib günahını bağışlayar. Hz. Peyğəmbər belə deyəndə Aişənin gözünün yaşı qurudu. Daha gözündən bir qətrə də yaş çıxmadı. Üzünü atası Əbu Bəkirə tutub dedi: "Mənim əvəzimdən Hz. Peyğəmbərə cavab ver." Əbu Bəkir dedi: "Mən nə cavab verim?" Ondan sonra atasına dedi: "Mənim Hz. Peyğəmbərə cavab verməyə bir sözüm yoxdur." Aişə o zaman azyaşlı olduğundan Qurani-Şərifi yaxşı bilməzdi. Axırda məcbur qalıb dedi: "Ey peyğəmbər, bilirəm ki, camaatın dediyi sözlərə inanıb təsdiq edirsiniz. Əgər desəm ki, o işdə günahsızam, Allah-Təala özü bilir ki, mən necə pakam. Amma siz paklığımı təsdiq etməyəcəksiniz. Əgər o günahı boynuma alsam, Allah-Təala bilir ki, mən o işdən uzağam. Amma siz günahımı təsdiq edəcəksiniz. Deməyə sözüm yoxdur, ancaq Yusifin ayrılığına düçar olan atasının sözünü deyirəm: "Gözəl şəkildə səbir edirəm, dediyiniz sözlərə görə də Allah-Təaladan kömək istəyirəm." Mən də bu sözü deyib səbir edirəm." Ondan sonra Aişə yatağa uzanıb ağlamağa başladı. Hz. Peyğəmbər oradan ayrılmamış, Allah-Təala Aişənin paklığı haqqında bundan sonra gələn 18 ayəni nazil etdi (Buxari, Şəhadət 15, 30; Təfsiru surə 24/6; Müslüm, Tövbə 56)**).**

**11)** (اِنَّ الَّذِينَ جَآؤُ بِالْاِفْكِ عُصْبَةٌ مِنْكُمْ) - (ey Məhəmməd)**, həqiqətən,** (Aişə haqqında) **yalandan iftira deyənlər, öz içinizdən olan bir camaatdır,** (لَا تَحْسَبُوهُ شَرًّا لَكُمْ بَلْ هُوَ خَيْرٌ لَكُمْ) – (o iftiranı) **özünüz üçün şər zənn etməyin, bəlkə o, sizdən ötrü xeyirlidir,** (Allah-Təala ondan ötrü sizə böyük əcr və savab verib, münafiqləri dünyada rüsvay edib axirətdə əzab edəcəkdir)**.** (لِكُلِّ امْرِئٍ مِنْهُمْ مَا اكْتَسَبَ مِنَ الْاِثْمِ) – (o şəxslərin) **hər birindən ötrü qazandığı günahın bir cəzası vardır,** (Allah-Təala hər birinə etdikləri böhtan qədər əzab edəcəkdir)**.** (وَالَّذِي تَوَلّٰى كِبْرَهُ مِنْهُمْ لَهُ عَذَابٌ عَظِيمٌ) – **o yalanın böyüyünü yüklənən** (Abdullah ibn Übeyy) **üçün isə** (axirətdə) **böyük olan əzab vardır.**

**12)** (لَوْلَآ اِذْ سَمِعْتُمُوهُ ظَنَّ الْمُؤْمِنُونَ وَالْمُؤْمِنَاتُ بِاَنْفُسِهِمْ خَيْرًا) – (siz müsəlmanlar) **bu yalan sözləri eşitdiyiniz zaman, niyə mömin kişilər və mömin qadınlar öz canları kimi olan şəxslərin** (Aişə və Səfvan) **barəsində yaxşı şey güman edib** (o sözü inkar etmədilər?) (وَقَالُوا هٰذَآ اِفْكٌ مُبِينٌ) **- gərək deyəydilər: bu söz açıq-aşkar iftiradır,** (mömin şəxs bir başqa mömin şəxsin haqqında

لَوْلَا جَٓاؤُ عَلَيْهِ بِاَرْبَعَةِ شُهَدَٓاءَۚ فَاِذْ لَمْ يَأْتُوا بِالشُّهَدَٓاءِ فَاُو۬لٰٓئِكَ عِنْدَ اللّٰهِ هُمُ الْكَاذِبُونَ ﴿١٣﴾ وَلَوْلَا
فَضْلُ اللّٰهِ عَلَيْكُمْ وَرَحْمَتُهُ فِي الدُّنْيَا وَالْاٰخِرَةِ لَمَسَّكُمْ فِي مَٓا اَفَضْتُمْ فِيهِ عَذَابٌ عَظِيمٌۚ ﴿١٤﴾
اِذْ تَلَقَّوْنَهُ بِاَلْسِنَتِكُمْ وَتَقُولُونَ بِاَفْوَاهِكُمْ مَا لَيْسَ لَكُمْ بِهٖ عِلْمٌ وَتَحْسَبُونَهُ هَيِّنًاۗ وَهُوَ عِنْدَ اللّٰهِ عَظِيمٌ
﴿١٥﴾ وَلَوْلَٓا اِذْ سَمِعْتُمُوهُ قُلْتُمْ مَا يَكُونُ لَنَٓا اَنْ نَتَكَلَّمَ بِهٰذَاۗ سُبْحَانَكَ هٰذَا بُهْتَانٌ عَظِيمٌ ﴿١٦﴾
يَعِظُكُمُ اللّٰهُ اَنْ تَعُودُوا لِمِثْلِه۪ٓ اَبَدًا اِنْ كُنْتُمْ مُؤْمِن۪ينَۚ﴿١٧﴾

---

pis söz eşidəndə gərək gözəl düşünüb o sözü inkar etsin. Necə ki Əbu Eyyub Ənsarinin arvadı inkar etdi. Əbu Eyyub arvadına dedi: "Görürsən, camaat Aişənin haqqında nə sözlər deyirlər?" Arvad dedi: "Əgər sən Səfvanın yerində olsaydın, Hz. Peyğəmbərin xanımına xəyanət etmək fikrində olardın?" Əbu Eyyub dedi: "Əlbəttə, olmazdım." Arvad dedi: "Əgər mən də Aişənin yerində olsaydım, heç vaxt Hz. peyğəmbərə xəyanət etməzdim. Aişə məndən, Səfvan səndən yaxşıdır. Heç vaxt onlar belə əməl etməz")**.**

**13)** (لَوْلَا جَٓاؤُ عَلَيْهِ بِاَرْبَعَةِ شُهَدَٓاءَ) – (əgər onların Aişə barəsində dedikləri sözləri doğrudursa)**, niyə** (sözlərinin doğruluğu üçün) **4 şahid gətirmirlər?** (Zina isnadının doğru,ya da yalan olması 4 şahidə bağlıdır. 4 şahid olsa, zina təsdiq olunar, əgər 4 şahid olmasa, zina təsdiq olunmayıb, bunu deyənlərin sözü yalan olar)**.** (فَاِذْ لَمْ يَأْتُوا بِالشُّهَدَٓاءِ فَاُو۬لٰٓئِكَ عِنْدَ اللّٰهِ هُمُ الْكَاذِبُونَ) – **bir halda ki,** (o iftira edənlər 4) **şahid gətirmədilərsə, demək onlar Allah-Təala yanında əsl yalançıdırlar.**

**14)** (وَلَوْلَا فَضْلُ اللّٰهِ عَلَيْكُمْ وَرَحْمَتُهُ فِي الدُّنْيَا وَالْاٰخِرَةِ) - **əgər Allah-Təalanın dünya və axirətdə sizə lütf və mərhəməti olmasaydı,** (dünyada hər cür nemətlər verib, o cümlədən tövbə üçün sizə möhlət verib, axirətdə də sizə rəhm edib günahlarınızı bağışlamasaydı)**,** (لَمَسَّكُمْ فِي مَٓا اَفَضْتُمْ فِيهِ عَذَابٌ عَظِيمٌ) - **hər halda** (Aişə haqqındakı) **yalan sözlərindən ötrü sizə böyük əzab toxunardı.**

**15)** (اِذْ تَلَقَّوْنَهُ بِاَلْسِنَتِكُمْ) – (Allah-Təala sizə əzab göndərdi)**, çünki o yalan sözü dilinizə gətirib** (bir-birinizə yayırdınız)**.** (وَتَقُولُونَ بِاَفْوَاهِكُمْ مَا لَيْسَ لَكُمْ بِهٖ عِلْمٌ) **– bilmədiyiniz şeyi ağzınızda deyirdiniz,** (insanın bilmədiyi şeyi danışması çirkin əməldir)**,** (وَتَحْسَبُونَهُ هَيِّنًا) – (Aişə haqqında deyilən sözü) **kiçik** (günahsız) **şey sayırdınız.** (وَهُوَ عِنْدَ اللّٰهِ عَظِيمٌ) - **halbuki o söz Allah-Təala yanında çox böyük** (günahdır)**.**

**16)** (وَلَوْلَٓا اِذْ سَمِعْتُمُوهُ قُلْتُمْ مَا يَكُونُ لَنَٓا اَنْ نَتَكَلَّمَ بِهٰذَا) - **o sözü eşitdiyinizdə, gərək, deyəydiniz ki, bizə bunu danışmaq layiq deyil,** (سُبْحَانَكَ هٰذَا بُهْتَانٌ عَظِيمٌ) - **ilahi, sən hər bir eyibdən pak və müqəddəssən. Bu söz** (Aişə haqqında) **böyük böhtandır.** (Heç vaxt belə şey olmaz)**.**

وَيُبَيِّنُ اللّٰهُ لَكُمُ الْاٰيَاتِ وَاللّٰهُ عَلٖيمٌ حَكٖيمٌ ﴿١٨﴾ اِنَّ الَّذٖينَ يُحِبُّونَ اَنْ تَشٖيعَ الْفَاحِشَةُ فِي الَّذٖينَ اٰمَنُوا
لَهُمْ عَذَابٌ اَلٖيمٌ فِي الدُّنْيَا وَالْاٰخِرَةِ وَاللّٰهُ يَعْلَمُ وَاَنْتُمْ لَا تَعْلَمُونَ ﴿١٩﴾ وَلَوْلَا فَضْلُ اللّٰهِ عَلَيْكُمْ
وَرَحْمَتُهُ وَاَنَّ اللّٰهَ رَؤُفٌ رَحٖيمٌ ﴿٢٠﴾ يَٓا اَيُّهَا الَّذٖينَ اٰمَنُوا لَا تَتَّبِعُوا خُطُوَاتِ الشَّيْطَانِ وَمَنْ يَتَّبِعْ
خُطُوَاتِ الشَّيْطَانِ فَاِنَّهُ يَأْمُرُ بِالْفَحْشَٓاءِ وَالْمُنْكَرِ وَلَوْلَا فَضْلُ اللّٰهِ عَلَيْكُمْ وَرَحْمَتُهُ مَا زَكٰى مِنْكُمْ مِنْ
اَحَدٍ اَبَدًا وَلٰكِنَّ اللّٰهَ يُزَكّٖي مَنْ يَشَٓاءُ وَاللّٰهُ سَمٖيعٌ عَلٖيمٌ ﴿٢١﴾

---

**17)** (يَعِظُكُمُ اللّٰهُ اَنْ تَعُودُوا لِمِثْلِهٖ اَبَدًا اِنْ كُنْتُمْ مُؤْمِنٖينَ) **- Allah-Təala sizə öyüd-nəsihət edir ki, əgər möminsiniz,** (bundan sonra nə qədər ömrünüz olsa da, Aişə haqqında dediyiniz) **bu kimi şeyləri, gərək, etməyib** (heç kimə də deməyəsiniz)**.**

**18)** (وَيُبَيِّنُ اللّٰهُ لَكُمُ الْاٰيَاتِ وَاللّٰهُ عَلٖيمٌ حَكٖيمٌ) **- Allah-Təala sizdən ötrü ayələrini** (şəriət ehkamını, öyüd-nəsihətini açıq-aydın) **bəyan edir. Allah-Təala hər bir şeydən agahdır, hikmət üzrə edəndir.**

**19)** (اِنَّ الَّذٖينَ يُحِبُّونَ اَنْ تَشٖيعَ الْفَاحِشَةُ فِي الَّذٖينَ اٰمَنُوا) **- həqiqətən, o şəxslər ki, möminlərin arasında** (Aişəyə isnad edilən) **qəbih sözləri yaymaq istəyir,** (لَهُمْ عَذَابٌ اَلٖيمٌ فِي الدُّنْيَا وَالْاٰخِرَةِ) **- onlardan ötrü həm dünyada, həm də axirətdə şiddətli əzab vardır.** (Dünya cəzası olaraq Hz. Peyğəmbər Abdullah ibn Übeyy, Həssan ibn Sabit və Mistah ibn Üsasəyə 80 çubuq həddi-qəzf cəzası tətbiq etdi, Səfvan ibn Müəttəl isə münafiq Abdullah ibn Übeyyin üzünə qılıncla vurub, Abdullahın gözü kor oldu, axirətdə isə cəhənnəm əzabı vardır)**.** (وَاللّٰهُ يَعْلَمُ وَاَنْتُمْ لَا تَعْلَمُونَ) – (qəlblərdə olan sirlərə və bu çirkin sözü yayanlara) **Allah-Təala agahdır, amma siz agah deyilsiniz.**

**20)** (وَلَوْلَا فَضْلُ اللّٰهِ عَلَيْكُمْ وَرَحْمَتُهُ) **- əgər Allah-Təalanın siz** (Mədinə əhlinə) **lütf və rəhməti olmasaydı,** (hər halda Aişəyə etdiyiniz bu böhtana görə sizə əzab göndərərdi)**.** (وَاَنَّ اللّٰهَ رَؤُفٌ رَحٖيمٌ) **həqiqətən, Allah-Təala** (sizə qarşı) **mehriban və rəhm edəndir.**

**21)** (يَٓا اَيُّهَا الَّذٖينَ اٰمَنُوا لَا تَتَّبِعُوا خُطُوَاتِ الشَّيْطَانِ) **- ey iman gətirən şəxslər, şeytanın izinə** (yoluna) **tabe olmayın,** (yəni Abdullah ibn Übeyyin sözünə tabe olub siz də onun kimi Aişə haqqında batil sözlər deməyin)**.** (وَمَنْ يَتَّبِعْ خُطُوَاتِ الشَّيْطَانِ فَاِنَّهُ يَأْمُرُ بِالْفَحْشَٓاءِ وَالْمُنْكَرِ) **- kim şeytanın** (Abdullah ibn Übeyyin izinə) **yoluna tabe olsa, həqiqətən, şeytan pis şeyləri** (sözləri) **əmr edər.** (وَلَوْلَا فَضْلُ اللّٰهِ عَلَيْكُمْ وَرَحْمَتُهُ مَا زَكٰى مِنْكُمْ مِنْ اَحَدٍ اَبَدًا) – (Aişəyə böhtan edəndən sonra tövbə etməniz səbəbilə) **əgər Allah-Təalanın sizə lütf və rəhməti olmasaydı, hər halda, sizdən heç kim pak olub** (nicat tapmazdı)**.** (وَلٰكِنَّ اللّٰهَ يُزَكّٖي مَنْ يَشَٓاءُ) **- lakin Allah-Təala kimi istəsə,** (sizdən tövbə edənləri günahdan) **pak edib** (nicat verər. Həssan ibn Sabit, Mistah ibn Üsasə, bir də Həmnə Cəhş qızı tövbə edib nicat tapdılar. Amma Abdullah ibn Übeyy nifaq içində qalıb dünyadan elə

وَلَا يَأْتَلِ اُولُوا الْفَضْلِ مِنْكُمْ وَالسَّعَةِ اَنْ يُؤْتُٓوا اُولِي الْقُرْبٰى وَالْمَسَاكِينَ وَالْمُهَاجِرِينَ فِي سَبِيلِ
اللّٰهِ وَلْيَعْفُوا وَلْيَصْفَحُواۜ اَلَا تُحِبُّونَ اَنْ يَغْفِرَ اللّٰهُ لَكُمْۜ وَاللّٰهُ غَفُورٌ رَحِيمٌ ﴿٢٢﴾ اِنَّ الَّذِينَ يَرْمُونَ
الْمُحْصَنَاتِ الْغَافِلَاتِ الْمُؤْمِنَاتِ لُعِنُوا فِي الدُّنْيَا وَالْاٰخِرَةِۖ وَلَهُمْ عَذَابٌ عَظِيمٌ ﴿٢٣﴾ يَوْمَ تَشْهَدُ
عَلَيْهِمْ اَلْسِنَتُهُمْ وَاَيْدِيهِمْ وَاَرْجُلُهُمْ بِمَا كَانُوا يَعْمَلُونَ ﴿٢٤﴾ يَوْمَئِذٍ يُوَفِّيهِمُ اللّٰهُ دِينَهُمُ الْحَقَّ
وَيَعْلَمُونَ اَنَّ اللّٰهَ هُوَ الْحَقُّ الْمُبِينُ ﴿٢٥﴾ اَلْخَبِيثَاتُ لِلْخَبِيثِينَ وَالْخَبِيثُونَ لِلْخَبِيثَاتِۚ

---

köçdü). (وَاللّٰهُ سَمِيعٌ عَلِيمٌ) - **Allah-Təala** (sizin sözlərinizi) **eşidən,** (qəlbinizdə olan xeyir və şəri) **biləndir.**

**22)** (وَلَا يَأْتَلِ اُولُوا الْفَضْلِ مِنْكُمْ وَالسَّعَةِ) - (Mistah ibn Usasə Əbu Bəkirin xalası nəvəsi, özü də kasıb mühacirlərdən olduğundan Əbu Bəkir ona himayə edib, xərcliyini verirdi. Mistah Aişə barəsində nalayiq sözlər dedikdə, Əbu Bəkir and içdi ki, bir də Mistaha yardım etməsin. Allah-Təala bu ayədə Əbu Bəkirə belə and içməyi qadağan edib Mistaha yardım etməsini əmr edir. Ayənin mənası belədir:) (ey möminlər)**, içinizdəki fəzilətli və varlı şəxslər** (Əbu Bəkir) **and içməsinlər ki,** (اَنْ يُؤْتُٓوا اُولِي الْقُرْبٰى وَالْمَسَاكِينَ وَالْمُهَاجِرِينَ فِي سَبِيلِ اللّٰهِ) **– qohum-əqrəbaya, yoxsullara və mühacirlərə Allah-Təala yolunda** (bir şey) **verməsinlər.** (Yəni Əbu Bəkir Mistaha yardım etməməyə and içməsin)**.** (وَلْيَعْفُوا وَلْيَصْفَحُوا) - **gərək, bağışlayıb** (günahlarından) **keçsinlər,** (xüsusən, tövbə edəndən sonra), (اَلَا تُحِبُّونَ اَنْ يَغْفِرَ اللّٰهُ لَكُمْ) – **bəs siz istəmirsiniz ki,** (sizə zülm edənləri bağışladığınız üçün) **Allah-Təala da sizi bağışlasın?** (وَاللّٰهُ غَفُورٌ رَحِيمٌ) - **Allah-Təala bağışlayıb** (bəndələrinə) **rəhm edəndir.** (Siz də Allah-Təala kimi olub bağışlamağı özünüzə adət edin. Hz. Peyğəmbər bu ayəni Əbu Bəkirə oxudu, Əbu Bəkir dedi: "Bəli, Allah-Təalanın məni bağışlamasını istəyirəm, vallah, nə qədər ömrüm var, Mistaha yardım edəcəyəm")**.**

**23)** (اِنَّ الَّذِينَ يَرْمُونَ الْمُحْصَنَاتِ الْغَافِلَاتِ الْمُؤْمِنَاتِ) **- həqiqətən, o şəxslər ki ismətli və** (çirkin əməllərdən) **qafil olan mömin qadınlara zina isnadı edir,** (necə ki, Aişəyə isnad etdilər), (لُعِنُوا فِي الدُّنْيَا وَالْاٰخِرَةِ) **- o şəxslərə həm dünyada və həm də axirətdə lənət edilər.** (وَلَهُمْ عَذَابٌ عَظِيمٌ) **- və onlardan ötrü axirətdə böyük əzab vardır.**

**24)** (يَوْمَ تَشْهَدُ عَلَيْهِمْ اَلْسِنَتُهُمْ وَاَيْدِيهِمْ وَاَرْجُلُهُمْ بِمَا كَانُوا يَعْمَلُونَ) – (Aişə və ondan başqa mömin qadınlara zina isnad edənlərin) **dilləri, əlləri, ayaqları etdikləri əməllərə görə, qiyamət günü onların əleyhinə şəhadət edər.**

**25)** (يَوْمَئِذٍ يُوَفِّيهِمُ اللّٰهُ دِينَهُمُ الْحَقَّ) – (qiyamət) **günü Allah-Təala** (böhtan atanlara) **layiq olduqları cəzalarını verər,** (وَيَعْلَمُونَ اَنَّ اللّٰهَ هُوَ الْحَقُّ الْمُبِينُ) – (qiyamət günü) **biləcəklər ki, həqiqətən, Allah-Təala açıq-aşkar haqq olan məbuddur.**

وَالطَّيِّبَاتُ لِلطَّيِّبِينَ وَالطَّيِّبُونَ لِلطَّيِّبَاتِۚ اُو۬لٰٓئِكَ مُبَرَّؤُنَ مِمَّا يَقُولُونَۜ لَهُمْ مَغْفِرَةٌ وَرِزْقٌ كَرِيمٌ۟ ﴿٢٦﴾
يَٓا اَيُّهَا الَّذِينَ اٰمَنُوا لَا تَدْخُلُوا بُيُوتًا غَيْرَ بُيُوتِكُمْ حَتّٰى تَسْتَأْنِسُوا وَتُسَلِّمُوا عَلٰٓى اَهْلِهَاۜ ذٰلِكُمْ خَيْرٌ
لَكُمْ لَعَلَّكُمْ تَذَكَّرُونَ ﴿٢٧﴾ فَاِنْ لَمْ تَجِدُوا فِيهَٓا اَحَدًا فَلَا تَدْخُلُوهَا حَتّٰى يُؤْذَنَ لَكُمْۚ وَاِنْ قِيلَ لَكُمُ
ارْجِعُوا فَارْجِعُوا هُوَ اَزْكٰى لَكُمْۜ وَاللّٰهُ بِمَا تَعْمَلُونَ عَلِيمٌ ﴿٢٨﴾

---

**26)** (اَلْخَبِيثَاتُ لِلْخَبِيثِينَ) **- xəbis və murdar şeylər** (zina və digər pisliklərə isnad etmək) **xəbis və murdar şəxslərə** (qəbih əməl sahiblərinə) **məxsusdur,** (nəinki Aişə və Səfvan kimi şəxslərə)**.** (وَالْخَبِيثُونَ لِلْخَبِيثَاتِ) **- xəbis və murdarlar da xəbis və murdar şeylərə məxsus olub** (xəbis şeylər danışırlar. Necə ki Abdullah ibn Übeyy və ondan başqa münafiqlər danışdılar)**.** (وَالطَّيِّبَاتُ لِلطَّيِّبِينَ) **- pak şeylər pak şəxslərə məxsusdur** (və onlardan peyda olar, amma pak şəxslərə xəbis şeylər isnad etmək böyük zülmdür)**.** (وَالطَّيِّبُونَ لِلطَّيِّبَاتِ) **- habelə pak şəxslər pak şeylərə məxsus olub** (pak sözlər danışarlar. Necə ki Əbu Eyyub və onun arvadı, onlardan başqa möminlər Aişə haqqında yayılan pis sözləri qəbul etməyib yaxşı və gözəl sözlər danışdılar)**.** (اُو۬لٰئِكَ مُبَرَّؤُنَ مِمَّا يَقُولُونَ) – (xəbis şeylər isnad edilən) **bu şəxslər o deyilən** (pis sözlərdən pak və) **uzaqdırlar.** (Heç vaxt Aişə və Səfvan belə əməl etməzlər)**.** (لَهُمْ مَغْفِرَةٌ وَرِزْقٌ كَرِيمٌ) – (Aişə, Səfvan və onlar kimi olanlara Allah-Təala yanında) **bağışlanıb** (cənnətə daxil olma)**, xeyir və bərəkətli ruzilər vardır.** (Aişənin haqqında nazil olan 18 ayə bitdi, əgər Qurani-Şərifin ayələrinə baxılıb, asilər barəsində nazil olan əzablara fikir verilsə, heç biri Aişəyə böhtan edənlərin barəsində vəd edilən əzablara bərabər ola bilməz. Bu, bütün insanların rəhbəri olan Hz. Peyğəmbərin şan və dərəcəsinin ucalığından ötrüdür, kim Hz. Peyğəmbərin şan-şərafətinə, cəlalına, əzəmət və şövkətinə agah olmaq istəsə, Aişə barəsində nazil olan bu 18 ayətə fikir verib düşünsün. Allah-Təalanın onun pak xanımına iftira edənlərə necə qəzəb edib və bu iftiranı Aişənin üzərindən necə götürdüyünü görsün. Növbəti ayələrdə Allah-Təala bizə gözəl əxlaqlı və ədəbli olmağı əmr edir)**.**

**27)** (يَٓا اَيُّهَا الَّذِينَ اٰمَنُوا لَا تَدْخُلُوا بُيُوتًا غَيْرَ بُيُوتِكُمْ حَتّٰى تَسْتَأْنِسُوا وَتُسَلِّمُوا عَلٰى اَهْلِهَا) **- ey iman gətirən şəxslər, öz evlərinizdən başqa evlərə izinsiz və ev əhlinə salam vermədən daxil olmayın,** (ذٰلِكُمْ خَيْرٌ لَكُمْ لَعَلَّكُمْ تَذَكَّرُونَ) **– bu** (şəkildə izin alıb özgə evlərə girməyiniz) **sizin üçün daha yaxşıdır, bəlkə düşünüb ibrət alasınız** (və bu şəkildə əməl edəsiniz)**.**

**28)** (فَاِنْ لَمْ تَجِدُوا فِيهَٓا اَحَدًا) **- əgər** (özgə evlərinə gedib orda izin almaq üçün) **bir nəfər tapmasanız,** (dayanıb səbir edin)**,** (فَلَا تَدْخُلُوهَا حَتّٰى يُؤْذَنَ لَكُمْ) **– sizə izin verilənə qədər** (o evə) **daxil olmayın,** (ancaq izindən sonra daxil olun)**.** (وَاِنْ قِيلَ لَكُمُ ارْجِعُوا فَارْجِعُوا هُوَ اَزْكٰى لَكُمْ) **- əgər sizə** (evə daxil olmağa izin verilməyib) **- qayıdın, deyilsə,** (daxil olmaqda israr etməyin, acıqlanmadan) **geri qayıdın,**

لَيْسَ عَلَيْكُمْ جُنَاحٌ اَنْ تَدْخُلُوا بُيُوتًا غَيْرَ مَسْكُونَةٍ فِيهَا مَتَاعٌ لَكُمْ ۜ وَاللّٰهُ يَعْلَمُ مَا تُبْدُونَ وَمَا تَكْتُمُونَ
﴿٢٩﴾ قُلْ لِلْمُؤْمِنِينَ يَغُضُّوا مِنْ اَبْصَارِهِمْ وَيَحْفَظُوا فُرُوجَهُمْ ذٰلِكَ اَزْكٰى لَهُمْ ۜ اِنَّ اللّٰهَ خَبِيرٌ بِمَا
يَصْنَعُونَ ﴿٣٠﴾ وَقُلْ لِلْمُؤْمِنَاتِ يَغْضُضْنَ مِنْ اَبْصَارِهِنَّ وَيَحْفَظْنَ فُرُوجَهُنَّ وَلَا يُبْدِينَ زِينَتَهُنَّ اِلَّا
مَا ظَهَرَ مِنْهَا وَلْيَضْرِبْنَ بِخُمُرِهِنَّ عَلٰى جُيُوبِهِنَّ ۖ

---

**bu sizin üçün daha pak** (və yaxşı davranışdır, sizin kamil insan olmanıza işarə edər). (وَاللّٰهُ بِمَا تَعْمَلُونَ عَلِيمٌ) **- Allah-Təala** (sizə əmr olunan hansı şeyləri) **etdiyinizi** (və etmədiyinizi) **bilir.**

**29)** (لَيْسَ عَلَيْكُمْ جُنَاحٌ اَنْ تَدْخُلُوا بُيُوتًا غَيْرَ مَسْكُونَةٍ فِيهَا مَتَاعٌ لَكُمْ) – **sizin üçün faydalı olan qeyri-məskun evlərə daxil olmanızda sizə bir günah yoxdur.** (Məsələn, karvansaralar, hamamlar, dükanlar və ümumi istifadə üçün açıq olan binalara daxil olmağa izin almaq lazım deyil, lakin bu yerlərə daxil olarkən gərək pis bir niyyət olmasın). (وَاللّٰهُ يَعْلَمُ مَا تُبْدُونَ وَمَا تَكْتُمُونَ) **- Allah-Təala aşkar etdiklərinizə də, gizlətdiklərinizə də agahdır,** (o binalara nə məqsədlə daxil olduğunuzu da bilir).

**30)** (قُلْ لِلْمُؤْمِنِينَ يَغُضُّوا مِنْ اَبْصَارِهِمْ) - (ey Məhəmməd), **möminlərə de ki, gözlərini** (Allahın haram etdiklərindən) **çevirib baxmasınlar.** (Zəməxşəri "Kəşşaf"da deyir: "Məhrəm arvadların üzlərindən başqa da tüklərinə, sinələrinə, döşlərinə, baldırlarına, ayaqlarına baxmaq caizdir. Amma yad qadınların ancaq üzlərinə, əllərinə, ayaqlarına baxmaq caizdir"). (وَيَحْفَظُوا فُرُوجَهُمْ) – (ey Məhəmməd, yenə möminlərə de ki,) **alətlərini** (zina və homoseksuallıqdan) **qorusunlar.** (ذٰلِكَ اَزْكٰى لَهُمْ) – (gözlərini və alətlərini haramdan qorumaq) **onların** (günah işləyib kirlənmələrindən daha yaxşı və) **pakdır.** (اِنَّ اللّٰهَ خَبِيرٌ بِمَا يَصْنَعُونَ) **- həqiqətən, Allah-Təala** (möminlərin halından və) **etdiklərindən xəbərdardır.** (Heç bir əməlləri Allah-Təalaya məxfi deyil).

**31)** (وَقُلْ لِلْمُؤْمِنَاتِ يَغْضُضْنَ مِنْ اَبْصَارِهِنَّ وَيَحْفَظْنَ فُرُوجَهُنَّ) - (ey Məhəmməd), **mömin qadınlara de ki, gözlərini** (harama baxmaqdan) **çevirib, alətlərini** ("fərc"lərini* zinaya düşməkdən) **qorusunlar.** (وَلَا يُبْدِينَ زِينَتَهُنَّ اِلَّا مَا ظَهَرَ مِنْهَا) – **öz-özünə görünən şeylər istisna olmaqla, zinət** (yerlərini) **aşkar etməsinlər,** (yad kişilərə göstərməsinlər. Təfsirçilərə görə, qadınların zinət yeri iki qisimdir, biri zahiri zinət (üz, əl və ayaq), ayəyə görə, bunları yad kişilərə göstərmək caizdir,

*(*Qeyd: Kişi və qadının ayıb yerlərinin ərəb dilində xüsusi adları var, amma "fərc" ləfzi hər ikisinə aiddir).*

ikinci qismi batini zinət (sinə, qulaq, əldə qolbaq, ayaqda xalxal yeri), bunları məhrəm olmayana göstərmək caiz deyil). (وَلْيَضْرِبْنَ بِخُمُرِهِنَّ عَلٰى جُيُوبِهِنَّ) – (Hz. Peyğəmbərin zamanında qadınların köynəklərinin yaxaları geniş olub

**وَلَا يُبْدِينَ زِينَتَهُنَّ اِلَّا لِبُعُولَتِهِنَّ اَوْ اٰبَائِهِنَّ اَوْ اٰبَاءِ بُعُولَتِهِنَّ اَوْ اَبْنَآئِهِنَّ اَوْ اَبْنَاءِ بُعُولَتِهِنَّ اَوْ اِخْوَانِهِنَّ اَوْ بَنِي اِخْوَانِهِنَّ اَوْ بَنِي اَخَوَاتِهِنَّ اَوْ نِسَآئِهِنَّ اَوْ مَا مَلَكَتْ اَيْمَانُهُنَّ اَوِ التَّابِعِينَ غَيْرِ اُولِي الْاِرْبَةِ مِنَ الرِّجَالِ اَوِ الطِّفْلِ الَّذِينَ لَمْ يَظْهَرُوا عَلٰى عَوْرَاتِ النِّسَآءِۖ وَلَا يَضْرِبْنَ بِاَرْجُلِهِنَّ لِيُعْلَمَ مَا يُخْفِينَ مِنْ زِينَتِهِنَّ وَتُوبُوٓا اِلَى اللّٰهِ جَمِيعًا اَيُّهَ الْمُؤْمِنُونَ لَعَلَّكُمْ تُفْلِحُونَ ﴿٣١﴾ وَاَنْكِحُوا الْاَيَامٰى مِنْكُمْ وَالصَّالِحِينَ مِنْ عِبَادِكُمْ وَاِمَآئِكُمْ**

---

sinələri və boğazlarının çuxuru görünərdi. Allah-Təala ayədə onlara belə əmr edir:) **yaxalarını baş örtükləri ilə örtsünlər,** (belə ki, sinələri və boğazları görsənməsin. Bu ayəyə təfsirçilərin verdiyi mənaya görə, qadınlar üzlərini, əllərini, ayaqlarını yad kişilərdən gizlətməli deyil, ancaq digər əzalarını örtüb gizlətməlidirlər, amma bəzi islami qruplara görə, tamamilə örtünmək dinin vacib şərtidir). (وَلَا يُبْدِينَ زِينَتَهُنَّ اِلَّا لِبُعُولَتِهِنَّ) **- qadınlar** (gizlin olan) **zinət** (yerlərini - sinələrini, qulaqlarını, biləklərini, topuqlarından yuxarısını gizlədib) **göstərməsinlər, ancaq öz ərlərinə** (və bundan sonra zikr olunan şəxslərə göstərmək caizdir). (اَوْ اٰبَائِهِنَّ) **- ya da öz atalarına,** (اَوْ اٰبَاءِ بُعُولَتِهِنَّ) **- ya da ərlərinin atalarına,** (اَوْ اَبْنَائِهِنَّ) **- ya da öz oğullarına,** (اَوْ اَبْنَاءِ بُعُولَتِهِنَّ)**- ya da ərlərinin** (özgə arvadlardan olan) **oğullarına,** (اَوْ اِخْوَانِهِنَّ) **- ya da öz qardaşlarına,** (اَوْ بَنِي اِخْوَانِهِنَّ) **- ya da öz qardaşlarının oğullarına,** (اَوْ بَنِي اَخَوَاتِهِنَّ) **- ya da bacılarının oğullarına,** (اَوْ نِسَائِهِنَّ) **- ya da özləri kimi olan** (ismətli, müsəlman və ya qeyri-müsəlman) **qadınlara,** (müsəlman da olsa əxlaqsız və fasiq qadınlara gizli zinət yerlərini göstərmək caiz deyil), (اَوْ مَا مَلَكَتْ اَيْمَانُهُنَّ) **- ya da sahib olduqları** (qulam və kənizlərə göstərmək caizdir. Bəzi təfsirçilərə görə burada məqsəd qulam yox, kənizdir, çünki qulam da yad kişidir. Amma Xazin təfsirində Ənəs ibn Malikdən rəvayət edilir ki, Hz. Peyğəmbər qızı Fatiməyə bir qulam bağışladı. Fatimə qulamı görüb bir libas götürdü, başını örtmək istədi, ayaqları açıq qaldı, ayaqlarını örtmək istədi, başı açıq qaldı, Hz. Peyğəmbər buyurubdur: "Qızım, heç bir eyib yoxdur, atandan və öz qulamından gizlənmək lazım deyil." Habelə Zəməxşəri "Kəşşaf"da Aişədən nəql edib deyir: "Aişə öz qulamlarına zinət yerlərinə baxmağa izin vermişdi"). (اَوِ التَّابِعِينَ غَيْرِ اُولِي الْاِرْبَةِ مِنَ الرِّجَالِ) **- ya da ağılsız** (və ya qoca, kişiliyi olmayan) **xidmətçilərə** (gizli zinət yerlərini aşkar etmək caizdir). (اَوِ الطِّفْلِ الَّذِينَ لَمْ يَظْهَرُوا عَلٰى عَوْرَاتِ النِّسَاءِ) **- ya da qadınların məhrəm yerlərinə agah olmayan uşaqlara** (yəni həddi-büluğa çatmayıb hələ kişiləşmədikləri üçün onlara gizli zinət yerlərini göstərmək caizdir. Qadınların bu şəxslərdən başqa, heç kimə gizli zinət yerlərini göstərmələri caiz deyildir). (وَلَا يَضْرِبْنَ بِاَرْجُلِهِنَّ لِيُعْلَمَ مَا يُخْفِينَ مِنْ زِينَتِهِنَّ) – (ayaqlarında olan xalxal) **zinətləri aşkar olmasın deyə** (qadınlar) **ayaqlarını** (yerə möhkəm) **vurmasınlar,** (xalxal zinəti ərəblərə məxsusdur). (وَتُوبُوا اِلَى اللّٰهِ جَمِيعًا اَيُّهَ الْمُؤْمِنُونَ لَعَلَّكُمْ تُفْلِحُونَ) **– ey möminlər,** (bir günah etdiyinizdə)

اِنْ يَكُونُوا فُقَرَآءَ يُغْنِهِمُ اللّٰهُ مِنْ فَضْلِهٖ وَاللّٰهُ وَاسِعٌ عَلٖيمٌ ﴿٣٢﴾ وَلْيَسْتَعْفِفِ الَّذٖينَ لَا يَجِدُونَ نِكَاحًا
حَتّٰى يُغْنِيَهُمُ اللّٰهُ مِنْ فَضْلِهٖ وَالَّذٖينَ يَبْتَغُونَ الْكِتَابَ مِمَّا مَلَكَتْ اَيْمَانُكُمْ فَكَاتِبُوهُمْ اِنْ عَلِمْتُمْ فٖيهِمْ خَيْرًا

---

**tövbə edib** (Allah-Təalaya dönün)**, bəlkə** (tövbə etməklə Allah-Təalanın əzabından) **nicat tapıb** (nemətlərinə qovuşasınız)**.**

**32)** (وَاَنْكِحُوا الْاَيَامٰى مِنْكُمْ وَالصَّالِحٖينَ مِنْ عِبَادِكُمْ وَاِمَائِكُمْ) – **içinizdəki ərsiz qadınları və subay kişiləri, bir də əməlisaleh olan qulam və kənizlərinizi bir-biriləri ilə evləndirin,** (belə ki, subay qalmasınlar). (اِنْ يَكُونُوا فُقَرَاءَ يُغْنِهِمُ اللّٰهُ مِنْ فَضْلِهٖ) – **kasıb olsalar da** (onları evləndirin)**.* Allah-Təala öz lütf və rəhmətiylə onları zəngin edər.** (وَاللّٰهُ وَاسِعٌ عَلٖيمٌ) **- Allah-Təala geniş** (bol lütf sahibidir, insanları varlı etmədə aciz deyil, kimə bol ruzi verib-verməməyə də özü) **agahdır.**

*(*Qeyd: Evlənmək xüsusunda Hz. Peyğəmbərdən bir çox hədis rəvayət olunubdur. Evlənənlərə bəzi savablar da vəd edilibdir. Bəzi əyləncə düşkünləri peyğəmbərin: "Kim evlənər və cinsi əlaqədən sonra qüsl edərsə, qüslün hər bir qətrəsindən bir mələk yaranıb, onlardan ötrü bağışlanmaq dilər", -hədisini hərfi mənada anlayıb cinsi əlaqənin çoxluğundan özlərini məhv edirlər ki, o əcr və savaba nail olsunlar, amma bundan qafil olublar ki, sadəcə cinsi əlaqənin bir savabı olmaz. Hz. Peyğəmbərin evlənməyi əmr etməkdə məqsədi müsəlmanların sayını artırmağı təşviq etməkdir).*

**33)** (وَلْيَسْتَعْفِفِ الَّذٖينَ لَا يَجِدُونَ نِكَاحًا حَتّٰى يُغْنِيَهُمُ اللّٰهُ مِنْ فَضْلِهٖ) – **evlənməyə** (pul tapmayıb) **gücü çatmayanlar Allah-Təala öz lütf və rəhmətilə onları** (evlənməyə imkan verəcək qədər) **zəngin edincəyə qədər iffətlərini** (zinaya düşməkdən) **mühafizə etsinlər.** (Yəni kim maddi səbəblərlə evlənə bilməyib, səbir edərək zinaya düşməkdən özünü qorusa, güman etmədiyi yerdən Allah-Təala ona var-dövlət verər, o da şəriətə uyğun evlənər). (وَالَّذٖينَ يَبْتَغُونَ الْكِتَابَ مِمَّا مَلَكَتْ اَيْمَانُكُمْ) – **sahib olduğunuz** (qulam* və kənizlərdən) **o şəxslər ki,**

*(*Qeyd: Qulam və kənizlər insan olduğundan və insanların hamısı da eyni növ bir məxluq olduğundan bəzisinin digərlərinə üstün olub onlara bir heyvan kimi malik olması insafsızlıqdır. Qədim zamandan bəri bu əməl camaat arasında adət olub, bir çox insanlar da buna meyilli idi. Xalqa birdəfəlik bu əməli qadağan edib, ləğv etmək müşkül bir iş olduğundan Allah-Təala Qurani-Şərifdə bəzi məqamlarda qulam və kənizləri azad etməyin vacib olduğunu bildirib, Hz. Peyğəmbər də öz hədislərində onları azad edənlərə bir çox savablar vəd edib, xalqı buna təşviq edibdir. Belə ki, camaat özü bu mətləbin qəbahətini dərk edib yavaş-yavaş tərk etsinlər. Hz. Peyğəmbər, pak səhabələri və hidayət verən imamlar sahib olduqları qulam və kənizlərin əksəriyyətini azad edib sonra onlara bir iş tapşırardılar. Qul azad etmək haqqında Hz. Peyğəmbərdən bir çox hədislər rəvayət edilibdir).*

**müqavilə yazıb müəyyən bir məbləğə özlərini özlərinə satmağa tələb edir,** (فَكَاتِبُوهُمْ اِنْ عَلِمْتُمْ فٖيهِمْ خَيْرًا) **- əgər onlarda bir xeyir** (o məbləği vermə

وَاٰتُوهُمْ مِنْ مَالِ اللّٰهِ الَّذ۪يٓ اٰتٰيكُمْ وَلَا تُكْرِهُوا فَتَيَاتِكُمْ عَلَى الْبِغَٓاءِ اِنْ اَرَدْنَ تَحَصُّنًا لِتَبْتَغُوا عَرَضَ الْحَيٰوةِ الدُّنْيَاۜ وَمَنْ يُكْرِهْهُنَّ فَاِنَّ اللّٰهَ مِنْ بَعْدِ اِكْرَاهِهِنَّ غَفُورٌ رَح۪يمٌ ﴿٣٣﴾ وَلَقَدْ اَنْزَلْنَٓا اِلَيْكُمْ اٰيَاتٍ مُبَيِّنَاتٍ وَمَثَلًا مِنَ الَّذ۪ينَ خَلَوْا مِنْ قَبْلِكُمْ وَمَوْعِظَةً لِلْمُتَّق۪ينَ۟ ﴿٣٤﴾ اَللّٰهُ نُورُ السَّمٰوَاتِ وَالْاَرْضِۜ مَثَلُ نُورِه۪ كَمِشْكٰوةٍ ف۪يهَا مِصْبَاحٌۜ

---

gücü) **görsəniz, o vaxt da müqavilə yazıb özlərini özlərinə satın,** (islamdan əvvəl ərəblər arasında qulam, ya da kənizin özünü müəyyən bir məbləğə sahibindən satın alması adəti var idi, amma satmaq, satmamaq ixtiyarı sahibin özündə olardı. Allah-Təala bu ayədə bu məbləği verə bilən qulamların azad edilməsini təkid edir). (وَاٰتُوهُمْ مِنْ مَالِ اللّٰهِ الَّذ۪ي اٰتٰيكُمْ) – (ey müsəlmanlar)**, Allah-Təalanın sizə verdiyi maldan** (o qulam, kənizlərə verin ki, özlərini alıb azad etsinlər. Cahiliyyə zamanında varlı şəxslər bir çox kənizlər alıb onları zina etməyə vadar edib var-dövlət qazanardılar. Münafiqlərin başçısı Abdullah ibn Übeyyin Mədinədə 6 kənizi var idi. Onları zinaya vadar edib hər ay onlardan bir miqdar pul alırdı. Gərək, o məbləği hər ay ödəyəydilər. O kənizlərdən ikisi gedib bu çirkin hadisəni Hz. Peyğəmbərə şikayət etdilər. Bu xüsusda bundan sonra gələn ayə nazil oldu)**.** (وَلَا تُكْرِهُوا فَتَيَاتِكُمْ عَلَى الْبِغَٓاءِ اِنْ اَرَدْنَ تَحَصُّنًا) **- əgər kənizləriniz iffətlərini qorumaq istəsələr, onları zorla zina etməyə vadar etməyin,** (kənizlər özləri zina etmək istəsələr, o zaman da gərək, onlara mane olasınız, siz özünüz onları belə qəbih əmələ vadar edirsinizsə, nə pis iş görürsünüz)**,** (لِتَبْتَغُوا عَرَضَ الْحَيٰوةِ الدُّنْيَا) – (onları zinaya vadar edirsiniz ki, bu səbəblə) **dünya malı əldə edəsiniz.** (وَمَنْ يُكْرِهْهُنَّ فَاِنَّ اللّٰهَ مِنْ بَعْدِ اِكْرَاهِهِنَّ غَفُورٌ رَح۪يمٌ)**- kim zorla** (kənizləri zinaya) **vadar etsə, onların zorlanmasından** (zorla zinaya vadar ediləndən) **sonra Allah-Təala** (o kənizlərə) **rəhm edib bağışlayandır.**

**34)** (وَلَقَدْ اَنْزَلْنَٓا اِلَيْكُمْ اٰيَاتٍ مُبَيِّنَاتٍ) **- həqiqətən,** (bu Quranda bizim hökmlərimizi bəyan edən) **açıq-aydın ayələri sizə nazil etdik.** (وَمَثَلًا مِنَ الَّذ۪ينَ خَلَوْا مِنْ قَبْلِكُمْ وَمَوْعِظَةً لِلْمُتَّق۪ينَ) **- sizdən əvvəlki ümmətlərin məsəllərini və qissələrini və müttəqi şəxslərdən ötrü** (gözəl) **öyüd-nəsihətləri** (bu Quranda nazil etdik. Belə ki, o qissələrdən və nəsihətlərdən ibrət alıb insanlıq xüsusiyyətlərini əldə edəsiniz)**.**

**35)** (اَللّٰهُ نُورُ السَّمٰوَاتِ وَالْاَرْضِ) **-** (Allah-Təala öz müqəddəs Varlığının müxtəlif təzahürlərini anlatmaq üçün bu ayədə bir məsəl bəyan edir ki, o məsəlin səbəbinə yarasa günəşin şüasından kor olan kimi aləmlərin sahibi olan o müqəddəs Zatın dünya aləminə saçılan nurundan kor olanlar hidayətə yol tapıb o Zatın haqlılığına və şəriksiz olmasına agah olsunlar. Ayənin mənası belədir:) **səmaların və yerin* nuru Allah-Təaladır.** (مَثَلُ نُورِه۪ كَمِشْكٰوةٍ ف۪يهَا مِصْبَاحٌ)

اَلْمِصْبَاحُ فٖي زُجَاجَةٍ اَلزُّجَاجَةُ كَاَنَّهَا كَوْكَبٌ دُرِّيٌّ يُوقَدُ مِنْ شَجَرَةٍ مُبَارَكَةٍ زَيْتُونَةٍ لَا شَرْقِيَّةٍ وَلَا
غَرْبِيَّةٍ يَكَادُ زَيْتُهَا يُضٖيءُ وَلَوْ لَمْ تَمْسَسْهُ نَارٌ نُورٌ عَلٰى نُورٍ يَهْدِي اللّٰهُ لِنُورِهٖ مَنْ يَشَاءُ وَيَضْرِبُ اللّٰهُ
الْاَمْثَالَ لِلنَّاسِ وَاللّٰهُ بِكُلِّ شَيْءٍ عَلٖيمٌ ﴿٣٥﴾ فٖي بُيُوتٍ اَذِنَ اللّٰهُ اَنْ تُرْفَعَ وَيُذْكَرَ فٖيهَا اسْمُهُ

---

**-** (Allah-Təalanın) **nurunun misalı içində** (işıqlı) **bir çıraq olan** (divar oyuğundakı) **bir taxça** (çıraqdan) **kimidir.**

*(*Qeyd: Hər bir şeyin nuru o şeyin varlığından ibarətdir. Məsələn, Zeyd bir şəxsdir, onun nuru öz varlığından ibarətdir, əgər Zeyd var olmasa, dünyanın nurundan ona bir fayda olmaz. Səmaların və yerin nuru da onların varlığından ibarətdir. Allah-Təala səmaların və yerin nurudur, demək ayəyə görə bu mənadadır: yəni səmaların və yer, hətta bütün varlıqlar Allah-Təalanın mütləq Varlığının bir zərrəsi olduğundan bütün varlıqların vücudu Allah-Təalanın varlığı deməkdir. Necə ki evin içinə şüşədən əks edən şüa günəşin nurundan qaynaqlanır və ondan ibarətdir, bu da məcazən olmayıb, həqiqəti üzrə belədir, habelə ayədəki mənaya görə də bütün varlıqların Allah-Təalaya olan nisbəti şüanın günəşə olan nisbəti kimidir. Necə ki günəş doğarkən ondan yayılan şüalarla ətraf nurlanır, habelə yeganə müqəddəs varlıq olan Xaliqin bir zərrə şüasından bütün varlıqlar nurlanıb mövcud olur. Bu mənada Xacə Hafiz Şirazi nə gözəl deyir: "Bütün bu görünən şərabın kölgəsi və müxtəlif naxışlar qədəhi tutan şəxsin işığıdır, qədəhə düşdü". Bu səbəbdən də o səmaların və bütün varlıqların nuru və varlığının həqiqəti Allah-Təaladır, demək doğrudur).*

(اَلْمِصْبَاحُ فٖي زُجَاجَةٍ) **- o çıraq da bir şüşə** (qəndil) **içində olsun,** (çırağın şüşə içində olması onun nurunu daha da yayar). (اَلزُّجَاجَةُ كَاَنَّهَا كَوْكَبٌ دُرِّيٌّ) **- o şüşə də saflıqda, sanki, inci kimi olan** (Müştəri, Zöhrə, Süheyl və Mərrix) **kimi ulduzlardan biridir.** (يُوقَدُ مِنْ شَجَرَةٍ مُبَارَكَةٍ زَيْتُونَةٍ) **- o çıraq da bərəkətli zeytun ağacının** (yağından) **yandırılıb** (işıqlanır). (لَا شَرْقِيَّةٍ وَلَا غَرْبِيَّةٍ) – (o yağ) **nə şərqdə, nə də qərbdə** (yetişən zeytun ağacının yağından deyil. Bəlkə də, Şamda olan zeytun yağındandır ki, zeytun yağlarının ən yaxşısı Şamda bitən zeytunun yağıdır). (يَكَادُ زَيْتُهَا يُضٖيءُ وَلَوْ لَمْ تَمْسَسْهُ نَارٌ) **- o zeytunun yağı** (o qədər saf və bərraqdır ki,) **ona od toxunmasa da, öz-özünə işıqlanır,** (نُورٌ عَلٰى نُورٍ)**– o, nur üstündə nurdur,** (zeytun yağının saflığı, çırağın nuru və o çırağın şüşə içində olması, şüşənin də taxçanın içində olması, taxçanın da örtülü olması səbəbinə nur artıb, o çıraqdan böyük bir nur, nurlar nuru zahir olur, Allah-Təalanın nuru da ona bənzədilir. İnsan sənətiylə meydana gələn işıq heç kimə məxfi qalmadığı halda həqiqi bir nur olan Allah-Təalanın nuru necə də məxfi qalıb, camaat özünə başqa nur axtarır. Necə ki əlində çıraq olan bir şəxs od axtarsın, məgər bu zəlalət və cəhalət deyilmi? İnsana hər bir şeydən yaxın olan şey onun öz vücududur. İnsan öz vücudunun həqiqətinə agah olsa, hər halda öz rəbbini də tanıyar. Allah-Təala ona isnad edilən vəsflərdən müqəddəs və ucadır). (يَهْدِي اللّٰهُ لِنُورِهٖ مَنْ يَشَاءُ) **- Allah-Təala istədiyini** (ağılla haqqı axtaranları) **öz nuru tərəfə**

يُسَبِّحُ لَهُ فِيهَا بِالْغُدُوِّ وَالْاٰصَالِۙ ﴿٣٦﴾ رِجَالٌۙ لَا تُلْهٖيهِمْ تِجَارَةٌ وَلَا بَيْعٌ عَنْ ذِكْرِ اللّٰهِ وَاِقَامِ الصَّلٰوةِ وَاٖيتَٓاءِ
الزَّكٰوةِۙ يَخَافُونَ يَوْمًا تَتَقَلَّبُ فٖيهِ الْقُلُوبُ وَالْاَبْصَارُۙ ﴿٣٧﴾ لِيَجْزِيَهُمُ اللّٰهُ اَحْسَنَ مَا عَمِلُوا وَيَزٖيدَهُمْ مِنْ
فَضْلِهٖۜ وَاللّٰهُ يَرْزُقُ مَنْ يَشَٓاءُ بِغَيْرِ حِسَابٍ ﴿٣٨﴾ وَالَّذٖينَ كَفَرُٓوا اَعْمَالُهُمْ كَسَرَابٍ بِقٖيعَةٍ يَحْسَبُهُ الظَّمْاٰنُ
مَٓاءًۜ حَتّٰٓى اِذَا جَٓاءَهُ لَمْ يَجِدْهُ شَيْـًٔا وَوَجَدَ اللّٰهَ عِنْدَهُ فَوَفّٰيهُ حِسَابَهُۜ وَاللّٰهُ سَرٖيعُ الْحِسَابِۙ ﴿٣٩﴾

---

**hidayət edər,** (وَيَضْرِبُ اللّٰهُ الْاَمْثَالَ لِلنَّاسِ) **- Allah-Təala insanlar üçün misallar çəkir** (ki, hər şeyi asanlıqla anlayıb dərk etsinlər). (وَاللّٰهُ بِكُلِّ شَيْءٍ عَلٖيمٌ) **- hər bir şeyə agah olan Allah-Təaladır.**

**36-37)** (فٖي بُيُوتٍ اَذِنَ اللّٰهُ اَنْ تُرْفَعَ وَيُذْكَرَ فٖيهَا اسْمُهُ) - (həmin taxça və içindəki çıraq) **Allah-Təalanın** (mübarək adının) **ucalmasına və zikr edilməsinə izin verdiyi o evlərdədir** (məscidlərdədir), (يُسَبِّحُ لَهُ فٖيهَا بِالْغُدُوِّ وَالْاٰصَالِ رِجَالٌ) – **səhər-axşam** (o məscidlərdə Allah-Təalanı bəzi arif) **kişilər zikr edib təqdis edərlər.** (لَا تُلْهٖيهِمْ تِجَارَةٌ وَلَا بَيْعٌ عَنْ ذِكْرِ اللّٰهِ وَاِقَامِ الصَّلٰوةِ وَاٖيتَٓاءِ الزَّكٰوةِ)– (o kişilər elə kişilərdir ki,) **nə ticarət və nə də** (mənfəətli) **alış-veriş onları Allah-Təalanın zikrindən və namaz qılıb zəkat verməkdən yayındırmaz.** (يَخَافُونَ يَوْمًا تَتَقَلَّبُ فٖيهِ الْقُلُوبُ وَالْاَبْصَارُۙ) - (o kişilər elə kişilərdir ki,) **qəlblərin və gözlərin haldan hala düşəcəyi** (qiyamət) **gününün əzabından qorxarlar.**

**38)** (لِيَجْزِيَهُمُ اللّٰهُ اَحْسَنَ مَا عَمِلُوا وَيَزٖيدَهُمْ مِنْ فَضْلِهٖ) – (Allah-Təalanı zikr edib Ondan ona görə qorxarlar ki,) **Allah-Təala etdikləri əmələ** (ibadətə) **görə onlara ən gözəl şəkildə mükafat verib, lütf və kəramətindən də** (onların əcr və savabını) **artırsın.** (وَاللّٰهُ يَرْزُقُ مَنْ يَشَٓاءُ بِغَيْرِ حِسَابٍ) **- Allah-Təala** (axirət günündə öz lütf və kəramətindən) **istədiyinə saysız-hesabsız ruzilər** (nemətlər) **bəxş etsin.** (Necə ki dünyada bəzi şəxslərə səbəbsiz yerə saysız-hesabsız dünya malı bəxş edir).

**39)** (وَالَّذٖينَ كَفَرُٓوا اَعْمَالُهُمْ كَسَرَابٍ بِقٖيعَةٍ) **- o şəxslər ki, kafir olub Allah-Təalaya şərik qoşurlar, onların əməlləri** (isti havada) **düz yerdə görünən ilğıma* bənzəyər.** (يَحْسَبُهُ الظَّمْاٰنُ مَٓاءً) – (o ilğımı uzaqdan görən) **susuz şəxs onu su zənn edib** (tez-tələsik o tərəfə gedər). (حَتّٰٓى اِذَا جَٓاءَهُ لَمْ يَجِدْهُ شَيْـًٔا) **- gəlib** (ilğıma çatdıqda isə)**, heç bir şey tapmaz,** (kafirin əhvalı da belədir, kafir dünyada etdiyi xeyir əməllərlə əcr və savab qazandığını güman edər, lakin məhşərə getdikdə o əməllərinin ilğım kimi məhv olub fayda vermədiyini görər). (وَوَجَدَ اللّٰهَ عِنْدَهُ) – (ümid etdiyini qiyamət günü tapmayıb) **onun yanında** (əvəzində) **Allah-Təalanın** (əzabını) **tapar.**

*(***Qeyd:** İsti havalarda günorta vaxtlarında səhrada su kimi görünən şeyə ilğım (sərab) deyilir. Yəni necə ki bu ilğımın həqiqəti yoxdur, habelə kafir şəxs yaxşı əməllər etsə də onların nəticəsi olmayıb, o əməllərdən bir fayda əldə etməz).*

اَوْ كَظُلُمَاتٍ فٖي بَحْرٍ لُجِّيٍّ يَغْشٰيهُ مَوْجٌ مِنْ فَوْقِهٖ مَوْجٌ مِنْ فَوْقِهٖ سَحَابٌ ظُلُمَاتٌ بَعْضُهَا فَوْقَ بَعْضٍۜ
اِذَٓا اَخْرَجَ يَدَهُ لَمْ يَكَدْ يَرٰيهَاۜ وَمَنْ لَمْ يَجْعَلِ اللّٰهُ لَهُ نُورًا فَمَا لَهُ مِنْ نُورٍ۟ ﴿٤٠﴾ اَلَمْ تَرَ اَنَّ اللّٰهَ يُسَبِّحُ
لَهُ مَنْ فِي السَّمٰوَاتِ وَالْاَرْضِ وَالطَّيْرُ صَٓافَّاتٍۜ كُلٌّ قَدْ عَلِمَ صَلَاتَهُ وَتَسْبٖيحَهُۜ وَاللّٰهُ عَلٖيمٌ بِمَا يَفْعَلُونَ
﴿٤١﴾ وَلِلّٰهِ مُلْكُ السَّمٰوَاتِ وَالْاَرْضِۚ وَاِلَى اللّٰهِ الْمَصٖيرُ ﴿٤٢﴾ اَلَمْ تَرَ اَنَّ اللّٰهَ يُزْجٖي سَحَابًا ثُمَّ
يُؤَلِّفُ بَيْنَهُ ثُمَّ يَجْعَلُهُ رُكَامًا فَتَرَى الْوَدْقَ يَخْرُجُ مِنْ خِلَالِهٖۚ

---

(فَوَفّٰيهُ حِسَابَهُ) – **Allah-Təala onun haqq-hesabını görüb** (əməllərinin cəzasını verər)**.** (وَاللّٰهُ سَرٖيعُ الْحِسَابِ) **- Allah-Təala sürətlə haqq-hesab edib** (cəza verəndir. Allah-Təala bu ayədə kafirlərin əməllərinin faydasızlığını ilğıma bənzədir, necə ki onu uzaqdan görən şəxs aldanıb su hesab edir, lakin ora getdikdə, sudan bir şey tapmayıb məyus olur, habelə kafirlər də belədir, bundan sonra gələn ayədə kafirlərin əməllərini elə bir qaranlığa bənzədir ki, orada bir-birlərinin üstünə yığılıb zərər və əzaba düçar olarlar)**.**

**40)** (اَوْ كَظُلُمَاتٍ فٖي بَحْرٍ لُجِّيٍّ) **- ya da** (kafirlərin əməlləri) **dərin dənizdəki qaranlıqlar kimidir.** (يَغْشٰيهُ مَوْجٌ مِنْ فَوْقِهٖ مَوْجٌ) **- onun üstünə bir dalğa ucalıb, o dalğanın üstündən də başqa bir dalğa ucalar.** (مِنْ فَوْقِهٖ سَحَابٌ) **O dalğanın üstündə buludlar olsun** (ظُلُمَاتٌ بَعْضُهَا فَوْقَ بَعْضٍ) **– bir-birinin üstündə də qaranlıqlar.** (اِذَٓا اَخْرَجَ يَدَهُ لَمْ يَكَدْ يَرٰيهَا) – (o şəxs o qaranlıqların içindən) **əlini çıxardıb baxsa da, az qala görməz,** (kafir və müşrikin halı da qiyamət günündə belədir, əməllərinin zülməti onları bürüyüb bir işıq tapmazlar ki, bir tərəfə gedə bilsinlər.) (وَمَنْ لَمْ يَجْعَلِ اللّٰهُ لَهُ نُورًا فَمَا لَهُ مِنْ نُورٍ) **-** (qiyamət günü) **Allah-Təala kimə** (öz əməlinə görə) **bir nur bəxş etməsə, əlbəttə, ondan ötrü işıqlıq olmaz.** (Həmişəlik qaranlıqda qalıb əzaba düçar olar)**.**

**41)** (اَلَمْ تَرَ اَنَّ اللّٰهَ يُسَبِّحُ لَهُ مَنْ فِي السَّمٰوَاتِ وَالْاَرْضِ) **-** (ey Məhəmməd)**, bəs baxıb görmürsən ki, səmalarda və yerdə olan hər bir məxluq Allah-Təalanı zikr edib** (ona həmd-səna edir?) (وَالطَّيْرُ صَٓافَّاتٍ) – (habelə yerlə səma arasında) **qanadlarını açıb uçan quşlar** (da Allah-Təalanı zikr edib həmd-səna edirlər. Səmalarda və yerdə olan məxluqatın hamısı dildən əlavə halları ilə də Allah-Təalanı zikr edir, hətta onların varlığı yeganə olan Allah-Təalaya dua edir. Allah-Təalanın quşlara və sair heyvanlara özünə həmd-səna edib zikr etməyi öyrətməsi imkansız deyil. Necə ki bəzi dəqiq və incə elmləri onlara öyrətdiyi məlumdur)**.** (كُلٌّ قَدْ عَلِمَ صَلَاتَهُ وَتَسْبٖيحَهُ) **Bütün məxluqat** (Allah üçün etdiyi) **dua və zikirləri bilir.** (Necə ki, dəqiq və lətif elmlərdən öyrənmə qabiliyyəti bəxş etmişdir. Eləcə də zövqü olan hər canlıya quşlara və sair heyvanata belə bir qabiliyyət vermişdir.) (وَاللّٰهُ عَلٖيمٌ بِمَا يَفْعَلُونَ) **- Allah-Təala edilən hər bir şeydən agahdır,** (onun elmindən bir şey qeyb olmaz)**.**

وَيُنَزِّلُ مِنَ السَّمَآءِ مِنْ جِبَالٍ فِيهَا مِنْ بَرَدٍ فَيُصِيبُ بِهِ مَنْ يَشَآءُ وَيَصْرِفُهُ عَنْ مَنْ يَشَآءُ يَكَادُ سَنَا بَرْقِهِ
يَذْهَبُ بِالْاَبْصَارِ ﴿٤٣﴾ يُقَلِّبُ اللّٰهُ الَّيْلَ وَالنَّهَارَ اِنَّ فِي ذٰلِكَ لَعِبْرَةً لِاُولِي الْاَبْصَارِ ﴿٤٤﴾ وَاللّٰهُ
خَلَقَ كُلَّ دَآبَّةٍ مِنْ مَآءٍ فَمِنْهُمْ مَنْ يَمْشِي عَلٰى بَطْنِهِ وَمِنْهُمْ مَنْ يَمْشِي عَلٰى رِجْلَيْنِ وَمِنْهُمْ مَنْ يَمْشِي
عَلٰى اَرْبَعٍ يَخْلُقُ اللّٰهُ مَا يَشَآءُ اِنَّ اللّٰهَ عَلٰى كُلِّ شَيْءٍ قَدِيرٌ ﴿٤٥﴾ لَقَدْ اَنْزَلْنَآ اٰيَاتٍ مُبَيِّنَاتٍ وَاللّٰهُ يَهْدِي
مَنْ يَشَآءُ اِلٰى صِرَاطٍ مُسْتَقِيمٍ ﴿٤٦﴾ وَيَقُولُونَ اٰمَنَّا بِاللّٰهِ وَبِالرَّسُولِ وَاَطَعْنَا ثُمَّ يَتَوَلّٰى فَرِيقٌ مِنْهُمْ مِنْ
بَعْدِ ذٰلِكَ وَمَآ اُولٰٓئِكَ بِالْمُؤْمِنِينَ ﴿٤٧﴾

---

**42)** (وَلِلّٰهِ مُلْكُ السَّمٰوَاتِ وَالْاَرْضِ وَاِلَى اللّٰهِ الْمَصِيرُ) **- səmaların və yerin hakimiyyəti Allah-Təalaya məxsus olub, son dönüş də Allah-Təalayadır.**

**43)** (اَلَمْ تَرَ اَنَّ اللّٰهَ يُزْجِي سَحَابًا) - (ey Məhəmməd)**, bəs baxıb görmürsən ki, Allah-Təala buludları** (öz kamil qüdrəti ilə hər tərəfə) **çəkib aparır.** (ثُمَّ يُؤَلِّفُ بَيْنَهُ ثُمَّ يَجْعَلُهُ رُكَامًا) **- ondan sonra** (dağınıq) **buludları bir yerə cəm edib, bir-birinin üstünə yığır.** (فَتَرَى الْوَدْقَ يَخْرُجُ مِنْ خِلَالِهِ) **– və görürsən ki,** (Allah-Təala öz kamil qüdrəti ilə o cəm olan buludların) **arasından yağış çıxardır.** (وَيُنَزِّلُ مِنَ السَّمَّاءِ مِنْ جِبَالٍ فِيهَا مِنْ بَرَدٍ) – (Allah-Təala) **səmadan dağlar kimi dolu endirir.** (فَيُصِيبُ بِهِ مَنْ يَشَّاءُ) **- Allah-Təala kimi istəsə, ona** (dolu ilə vurub özünə və əkininə) **zərər verər.** (وَيَصْرِفُهُ عَنْ مَنْ يَشَّاءُ) **- və kimi istəsə,** (o dolunu) **ondan qaytarıb** (bir zərər toxundurmaz)**.** (يَكَادُ سَنَا بَرْقِهِ يَذْهَبُ بِالْاَبْصَارِ) **– az qalır ki, buludlardan çıxan şimşəyin nuru gözlərini kor etsin.**

**44)** (يُقَلِّبُ اللّٰهُ الَّيْلَ وَالنَّهَارَ) **- Allah-Təala** (öz kamil qüdrəti ilə) **gecəni gündüzə** (gündüzü gecəyə) **çevirər,** (اِنَّ فِي ذٰلِكَ لَعِبْرَةً لِأُولِي الْاَبْصَارِ) **- həqiqətən, bu** (zikr olunan şeylərdə Allah-Təalanın tövhid və qüdrətinə dair) **ağıl sahiblərindən ötrü ibrət vardır.** (Yəni ağıllı insanlar, gərək, bu barədə təfəkkür etsinlər)**.**

**45)** (وَاللّٰهُ خَلَقَ كُلَّ دَآبَّةٍ مِنْ مَآءٍ) **-** (ey Məhəmməd)**, Allah-Təala** (yer üzündə olan) **hər bir heyvanı** (özünəməxsus) **bir spermadan yaradıbdır.** (فَمِنْهُمْ مَنْ يَمْشِي عَلٰى بَطْنِهِ) – (o heyvanlardan) **bəzisi qarnı üstündə yol gedər.** (وَمِنْهُمْ مَنْ يَمْشِي عَلٰى رِجْلَيْنِ) **- bəzisi də iki ayağı üstündə yol gedər.** (وَمِنْهُمْ مَنْ يَمْشِي عَلٰى اَرْبَعٍ) **- bəzisi də 4 ayağı üstündə yol gedər.** (يَخْلُقُ اللّٰهُ مَا يَشَّاءُ) **- Allah-Təala istədiyini yaradar,** (heç kim də ona mane ola bilməz)**.** (اِنَّ اللّٰهَ عَلٰى كُلِّ شَيْءٍ قَدِيرٌ) **- həqiqətən, Allah-Təala hər bir şeyə** (hər növ məxluq yaratmağa) **qadirdir.**

**46)** (لَقَدْ اَنْزَلْنَا اٰيَاتٍ مُبَيِّنَاتٍ) **- həqiqətən,** (ey Məhəmməd, bu Quranda halal, haramı bəyan edən) **açıq-aşkar ayələr nazil etdik** (ki, onlara əməl edib haqqa qovuşasınız)**.** (وَاللّٰهُ يَهْدِي مَنْ يَشَّاءُ اِلٰى صِرَاطٍ مُسْتَقِيمٍ) **- Allah-Təala kimi istəsə,** (etdiyi xeyir əməllərinə görə) **onu düz yola** (islama) **hidayət edər.**

وَاِذَا دُعُوٓا اِلَى اللّٰهِ وَرَسُولِه لِيَحْكُمَ بَيْنَهُمْ اِذَا فَرِيقٌ مِنْهُمْ مُعْرِضُونَ ﴿٤٨﴾ وَاِنْ يَكُنْ لَهُمُ الْحَقُّ
يَأْتُوٓا اِلَيْهِ مُذْعِنِينَ ﴿٤٩﴾ اَفِي قُلُوبِهِمْ مَرَضٌ اَمِ ارْتَابُوٓا اَمْ يَخَافُونَ اَنْ يَحِيفَ اللّٰهُ عَلَيْهِمْ وَرَسُولُهُ
بَلْ اُولٰٓئِكَ هُمُ الظَّالِمُونَ ﴿٥٠﴾ اِنَّمَا كَانَ قَوْلَ الْمُؤْمِنِينَ اِذَا دُعُوٓا اِلَى اللّٰهِ وَرَسُولِه لِيَحْكُمَ بَيْنَهُمْ
اَنْ يَقُولُوا سَمِعْنَا وَاَطَعْنَا وَاُولٰٓئِكَ هُمُ الْمُفْلِحُونَ ﴿٥١﴾ وَمَنْ يُطِعِ اللّٰهَ وَرَسُولَهُ وَيَخْشَ اللّٰهَ وَيَتَّقْهِ

---

**47)** (وَيَقُولُونَ اٰمَنَّا بِاللّٰهِ وَبِالرَّسُولِ وَاَطَعْنَا) – (münafiqlər zahirdə dillərində) **deyirlər: Allah-Təalaya və onun peyğəmbəri** (Məhəmmədə) **iman gətirib itaət etdik.** (ثُمَّ يَتَوَلّٰى فَرِيقٌ مِنْهُمْ مِنْ بَعْدِ ذٰلِكَ) – (bu sözü deyəndən) **sonra onlardan bir dəstə üz çevirib** (dedikləri sözlərindən, zahirdəki imanlarından da çıxarlar)**.** (وَمَٓا اُولٰٓئِكَ بِالْمُؤْمِنِينَ) – (ey Məhəmməd, bu sözləri deyənlər əvvəlcədən) **mömin olmayıb** (qəlbləri qəflətdə idi. Mədinədə olan bəzi münafiqlər zahirdə Hz. Peyğəmbərə iman gətirmişdilər, amma əleyhlərinə olan bir əhvalat və məhkəmə olanda dərhal Hz. peyğəmbərdən üz döndərib yəhudi rəislərinin hökmünə tabe olurdular. O cümlədən Bişr adlı bir münafiq bir yəhudi ilə mübahisə etdi. Yəhudi dedi: "Gedək Hz. Peyğəmbərin yanına." Bişr dedi: "Gedək yəhudilərin rəisi Kə`b ibnül-Əşrəfin yanına." Bir də Müğirə ibn Vaillə Əli ibn Əbu Talib arasında bir su quyusu və bir yerin üstündə ədavət oldu. Müğirə dedi: "Mən məhkəmə üçün Məhəmmədin yanına getmərəm. Qorxuram mənə zərər versin." Bundan sonra gələn bəzi ayələr bu barədə nazil oldu)**.**

**48)** (وَاِذَا دُعُوا اِلَى اللّٰهِ وَرَسُولِه لِيَحْكُمَ بَيْنَهُمْ) - (ey Məhəmməd)**, o münafiqlər aralarında hökm etməsi üçün Allah-Təalanın** (Quranı) **və onun peyğəmbərinin tərəfinə dəvət olunduqda,** (اِذَا فَرِيقٌ مِنْهُمْ مُعْرِضُونَ) – (qəfildən o münafiqlərdən) **bir dəstənin** (Allah-Təalanın və onun peyğəmbərinin hökmünə razı olmayıb) **üz çevirdiklərini** (görərsən)**.**

**49)** (وَاِنْ يَكُنْ لَهُمُ الْحَقُّ يَأْتُوا اِلَيْهِ مُذْعِنِينَ) - **amma** (məhkəmədə) **haqq onların** (mənfəətinə) **olsa, o vaxt da** (peyğəmbərə meyil və) **itaət edib onun yanına gəlib** (hökmünə razı olarlar)**.**

**50)** (اَفِي قُلُوبِهِمْ مَرَضٌ) - (ey Məhəmməd, niyə bu münafiqlər öz zərərlərinə olanda sənin hökmünə razı olmurlar?) **Yoxsa qəlblərində** (küfr və nifaq) **xəstəliyi var?** (اَمِ ارْتَابُوا) **- bəlkə** (sənin peyğəmbərliyinə) **şəkk-şübhə edirlər?** (اَمْ يَخَافُونَ اَنْ يَحِيفَ اللّٰهُ عَلَيْهِمْ وَرَسُولُهُ) **- yoxsa qorxurlar ki, Allah-Təala və onun peyğəmbəri** (Hz. Məhəmməd) **onlara zülm edib,** (haqları yeyilər? Onların bu gümanı batildir, heç vaxt onlara zülm olunmaz)**.** (بَلْ اُولٰٓئِكَ هُمُ الظَّالِمُونَ) **xeyr, onlar özləri zalımdırlar.**

**51)** (اِنَّمَا كَانَ قَوْلَ الْمُؤْمِنِينَ اِذَا دُعُوا اِلَى اللّٰهِ وَرَسُولِه لِيَحْكُمَ بَيْنَهُمْ اَنْ يَقُولُوا سَمِعْنَا وَاَطَعْنَا) **- həqiqətən, aralarında hökm edilsin deyə Allah-Təalanın və onun peyğəmbərinin** (Hz. Məhəmmədin) **tərəfinə çağırıldıqda, möminlərin sözü**

فَاُولٰٓئِكَ هُمُ الْفَٓائِزُونَ﴿٥٢﴾وَاَقْسَمُوا بِاللّٰهِ جَهْدَ اَيْمَانِهِمْ لَئِنْ اَمَرْتَهُمْ لَيَخْرُجُنَّ ۜ قُلْ لَا تُقْسِمُواۚ طَاعَةٌ
مَعْرُوفَةٌ ۜ اِنَّ اللّٰهَ خَبِيرٌ بِمَا تَعْمَلُونَ﴿٥٣﴾قُلْ اَطِيعُوا اللّٰهَ وَاَطِيعُوا الرَّسُولَۚ فَاِنْ تَوَلَّوْا فَاِنَّمَا عَلَيْهِ مَا
حُمِّلَ وَعَلَيْكُمْ مَا حُمِّلْتُمْ ۜ وَاِنْ تُطِيعُوهُ تَهْتَدُواۜ وَمَا عَلَى الرَّسُولِ اِلَّا الْبَلَاغُ الْمُبِينُ﴿٥٤﴾وَعَدَ اللّٰهُ
الَّذِينَ اٰمَنُوا مِنْكُمْ وَعَمِلُوا الصَّالِحَاتِ لَيَسْتَخْلِفَنَّهُمْ فِي الْاَرْضِ كَمَا اسْتَخْلَفَ الَّذِينَ مِنْ قَبْلِهِمْ ۖ

---

**gərək bu olsun:** (Allah-Təalanın və peyğəmbərin hökmünü) **eşidib itaət etdik.** (Möminlər bu xüsusiyyətdədir, nəinki faydalarına olanda razı olub, zərərlərinə olanda hökmə razı olmasınlar). (وَاُولٰٓئِكَ هُمُ الْمُفْلِحُونَ) **- əlbəttə, nicat tapıb** (axirətin sonsuz nemətlərinə qovuşanlar bu möminlərdir)**.**

**52)** (وَمَنْ يُطِعِ اللّٰهَ وَرَسُولَهُ) **- kim Allah-Təalaya və onun peyğəmbərinə itaət edib** (onların hökmünü qəbul etsə)**,** (وَيَخْشَ اللّٰهَ وَيَتَّقْهِ) **- və Allah-Təaladan qorxub çəkinsə,** (haramı tərk edib vaciblərə əməl etsə)**,** (فَاُولٰٓئِكَ هُمُ الْفَٓائِزُونَ) **– onlar əlbəttə,** (Allah-Təalanın) **əbədi nemətlərinə qovuşarlar.**

**53)** (وَاَقْسَمُوا بِاللّٰهِ جَهْدَ اَيْمَانِهِمْ لَئِنْ اَمَرْتَهُمْ لَيَخْرُجُنَّ) – (münafiqlər) **Allah-Təalaya çox möhkəm and içib** (sənə dedilər ki,) **əgər sən onlara** (cihada getməyi) **əmr etsən, mütləq** (səninlə cihada) **gedərlər.** (قُلْ لَا تُقْسِمُوا طَاعَةٌ مَعْرُوفَةٌ)- (ey Məhəmməd, o münafiqlərə) **de ki, and içməyin,** (and içmək lazım deyil, bəlkə özgə möminlər kimi şəkk-şübhəsiz itaət lazımdır. Necə ki mömin şəxslərin zahir və batinləri hər ikisi eynidir, gərək, siz də onlar kimi olasınız, necə itaət etdiyiniz məlumdur)**,** (اِنَّ اللّٰهَ خَبِيرٌ بِمَا تَعْمَلُونَ) **- həqiqətən, Allah-Təala etdiklərinizə,** (qəlbinizdə olan küfr və nifaqa) **agahdır.** (Heç bir şey ona məxfi qalmayıb əməlinizin cəzasını verəcəkdir)**.**

**54)** (قُلْ اَطِيعُوا اللّٰهَ وَاَطِيعُوا الرَّسُولَ) – (ey Məhəmməd, münafiqlərə) **de ki, Allah-Təalaya və onun peyğəmbərinə** (təmiz qəlblə) **itaət edin.** (فَاِنْ تَوَلَّوْا فَاِنَّمَا عَلَيْهِ مَا حُمِّلَ) **- əgər Allah-Təaladan və onun peyğəmbərindən üz çevirib itaət etməsəniz,** (peyğəmbərə bir zərər olmayıb, o zərər sizə dəyər, həqiqətən, peyğəmbərə lazım olan ancaq ona yüklənən (Allah-Təalanın ehkamını xalqa çatdırmaqdır)**,** (وَعَلَيْكُمْ مَا حُمِّلْتُمْ) **- sizə də lazım olan sizə yüklənən** (o ehkamlara əməl etməkdir, gərək, peyğəmbərə itaət edib, şəriəti qəbul edib əməl edəsiniz, əgər əməl etməsəniz, Allah-Təalanın qəzəbinə düçar olub əzaba yaxalanacaqsınız)**.** (وَاِنْ تُطِيعُوهُ تَهْتَدُوا) **- əgər** (peyğəmbərə) **itaət edib** (Allah-Təalanın ehkamına əməl etsəniz)**, hidayət tapıb** (zəlalətdən çıxarsınız)**.** (وَمَا عَلَى الرَّسُولِ اِلَّا الْبَلَاغُ الْمُبِينُ) **- peyğəmbərə lazım olan ancaq** (Allah-Təalanın hökmünü camaata) **açıq-aşkar təbliğ edib** (çatdırmaqdır)**.**

**55)** (وَعَدَ اللّٰهُ الَّذِينَ اٰمَنُوا مِنْكُمْ وَعَمِلُوا الصَّالِحَاتِ لَيَسْتَخْلِفَنَّهُمْ فِي الْاَرْضِ) **sizlərdən - Allah-Təala* iman gətirib saleh əməl edənlərə vəd edir ki, yer üzündə** (onları kafir və müşriklərin əvəzinə özünə canişin və) **varis etsin.** (كَمَا اسْتَخْلَفَ

وَلَيُمَكِّنَنَّ لَهُمْ دِينَهُمُ الَّذِي ارْتَضٰى لَهُمْ وَلَيُبَدِّلَنَّهُمْ مِنْ بَعْدِ خَوْفِهِمْ اَمْنًاۜ يَعْبُدُونَنِي لَا يُشْرِكُونَ بِي شَيْـًٔاۜ وَمَنْ كَفَرَ بَعْدَ ذٰلِكَ فَاُولٰٓئِكَ هُمُ الْفَاسِقُونَ ﴿٥٥﴾ وَاَقِيمُوا الصَّلٰوةَ وَاٰتُوا الزَّكٰوةَ وَاَطِيعُوا الرَّسُولَ لَعَلَّكُمْ تُرْحَمُونَ ﴿٥٦﴾

---

(الَّذِينَ مِنْ قَبْلِهِمْ) **- necə ki onlardan əvvəlkiləri də** (bəni-İsraili Misirdə və Şamda olan kafirlərin yerinə) **varis etmişdi.**

*(*Qeyd: Bu ayədə Allah-Təala Hz. Peyğəmbərin cövhər saçan dili ilə möminlərə vəd edir ki, bundan sonra böyük hökmdarlara qalib olub onların mülklərinə malik olacaqsınız. Allah-Təalanın bu vədi doğru olub peyğəmbərdən sonra xəlifələrin zamanında islam ümməti şərq və qərbə, Rum və İran padşahlarının xəzinələrinə sahib olub bütün dünyaya hakim oldular. Bu xəbər bizim məşhur peyğəmbərimizin haqq olduğuna dair bir möcüzədir. Peyğəmbərin böyük möcüzəsi qabaqcadan bir xəbər verib, o xəbərin gələcəkdə doğru olmasıdır. Haqq xəlifələrdən sonra özünə xəlifə adını qoyanlar onların yolu ilə getməyib haqqa nankorluq edib, əksəriyyəti də fasiq olduğundan, islam dini günbəgün geriləməyə başladı. Zəməxşəri öz təfsiri "Kəşşaf"da Hz. peyğəmbərdən bir hədis nəql edib deyir: "Hz. peyğəmbər buyurubdur: "Məndən sonra xilafət 30 ildir, ondan sonra kim güclü olsa, xilafətə sahib onu səltənət edər. Ondan sonra yol kəsib, qan tökmək və zülmlə xalqın malını əlindən almaq adət olar." Əməvilər xilafəti ələ keçirəndən sonra zikr olunan bu əməllər camaatın arasında yavaş-yavaş rəvac tapmağa başladı. Xalq bu cür əməllərdən asudə ola bilmədi. Bizim bu zamana kimi islam ümməti arasında hər cür zülm və fəsad, haqqa zidd əməllər davam edib, hamısı Əməvilərin və onlardan sonra da Abbasilərin əkdiyi toxumların bəhrəsidir. Bu mətləb heç bir tarixçiyə məxfi deyildir. Məsələn, Əməvi xəlifəsi Vəlid ibn Yezid ibn Əbdülməlik ancaq şərab içmək, başqa günah əməllər etməkdən başqa bir iş görməyibdir. Hovuzu şərabla doldurub gedib o hovuzun içinə dalıb şərab içib, sərxoş olub yatardı. Sübh vaxtı müəzzin gəlib (şərab tuluğu olan) bu xəlifəni camaat namazına dəvət edəndə, sərxoş xəlifə özündən bixəbər olduğundan özü kimi günahkar olan kənizinin sayəsində ayağa durub, sərxoş və qüslsüz bir halda gedib camaata namaz qıldırardı. Bu kimi əhvalatlar o dövrdəki camaatın əxlaqi vəziyyəti haqqında bizə məlumat verir. Habelə Ömər ibn Əbdüləziz istisna olmaqla Əməvi xəlifələri və Abbasi xəlifələrinin əksəriyyəti gecə-gündüz günah etməkdən başqa bir şey etməyib islama zərər verib, islam dünyasını xarabaya çevirdilər. Bu dövrdə, ya da bizdən əvvəlki dövrlərdə müsəlmanların içindən adil bir sultan çıxıb bu fəsadları islah etmək istəsə də, çətindir. Gərək, islam hökmdarları və müsəlmanlar öz nəfslərinə tabe olub, haqq yoldan çıxmasınlar və xeyir əməllərə davam edib onu möhkəmlətsinlər. Görəsən, islam ümməti o ilk xoş günlərinin bənzərini bir də görəcəkmi? Heyhat!).*

(وَلَيُمَكِّنَنَّ لَهُمْ دِينَهُمُ الَّذِي ارْتَضٰى لَهُمْ) – (Allah-Təala möminlərdən ötrü) **seçdiyi dinini** (islamı yer üzündə möhkəmləndirib (yayacaqdır). (وَلَيُبَدِّلَنَّهُمْ مِنْ بَعْدِ خَوْفِهِمْ اَمْنًا) **- əlbəttə,** (bu möminlərin Mədinədəki) **qorxularını sonra əmin-amanlıqla əvəz edəcəkdir.** (يَعْبُدُونَنِي لَا يُشْرِكُونَ بِي شَيْـًٔا) – (möminlər) **yalnız mənə ibadət edib heç bir şeyi mənə şərik qoşmazlar.** (وَمَنْ كَفَرَ بَعْدَ ذٰلِكَ فَاُولٰٓئِكَ هُمُ

لَا تَحْسَبَنَّ الَّذِينَ كَفَرُوا مُعْجِزِينَ فِي الْاَرْضِۚ وَمَأْوٰيهُمُ النَّارُۜ وَلَبِئْسَ الْمَصِيرُ۟﴿٥٧﴾ يَا اَيُّهَا الَّذِينَ اٰمَنُوا
لِيَسْتَأْذِنْكُمُ الَّذِينَ مَلَكَتْ اَيْمَانُكُمْ وَالَّذِينَ لَمْ يَبْلُغُوا الْحُلُمَ مِنْكُمْ ثَلٰثَ مَرَّاتٍ مِنْ قَبْلِ صَلٰوةِ الْفَجْرِ
وَحِينَ تَضَعُونَ ثِيَابَكُمْ مِنَ الظَّهِيرَةِ وَمِنْ بَعْدِ صَلٰوةِ الْعِشَاءِۜ ثَلٰثُ عَوْرَاتٍ لَكُمْۜ لَيْسَ عَلَيْكُمْ وَلَا عَلَيْهِمْ
جُنَاحٌ بَعْدَهُنَّۜ طَوَّافُونَ عَلَيْكُمْ بَعْضُكُمْ عَلٰى بَعْضٍۜ كَذٰلِكَ يُبَيِّنُ اللّٰهُ لَكُمُ الْاٰيَاتِۜ وَاللّٰهُ عَلِيمٌ حَكِيمٌ
﴿٥٨﴾ وَاِذَا بَلَغَ الْاَطْفَالُ مِنْكُمُ الْحُلُمَ فَلْيَسْتَأْذِنُوا كَمَا اسْتَأْذَنَ الَّذِينَ مِنْ قَبْلِهِمْۜ كَذٰلِكَ يُبَيِّنُ اللّٰهُ لَكُمْ اٰيَاتِهٖ

---

(الْفَاسِقُونَ) **- kim bu** (nemətlərə sahib olandan) **sonra nankorluq edib** (şükür etməsə)**, əsl fasiqdir.**

**56)** (وَاَقِيمُوا الصَّلٰوةَ وَاٰتُوا الزَّكٰوةَ وَاَطِيعُوا الرَّسُولَ لَعَلَّكُمْ تُرْحَمُونَ)**- namaz qılıb, zəkat verib, peyğəmbərin** (hər bir əmrinə) **itaət edin,** (ondan sonra ümid edin ki, Allah-Təala sizi bağışlayıb) **rəhm etsin.**

**57)** (لَا تَحْسَبَنَّ الَّذِينَ كَفَرُوا مُعْجِزِينَ فِي الْاَرْضِ) - (ey Məhəmməd)**, zənn etmə ki, kafir olanlar yer üzündə bizi aciz edərlər.** (وَمَأْوٰيهُمُ النَّارُ وَلَبِئْسَ الْمَصِيرُ) – (əksinə, biz onlara hakim olacağıq)**, məskənləri cəhənnəm odu olub** (həmişə orada qalacaqlar. Onlardan ötrü cəhənnəm) **nə pis qayıdış yeridir.**

**58)** (يَا اَيُّهَا الَّذِينَ اٰمَنُوا) **- ey iman gətirən şəxslər,** (Allah-Təala bu ayədə qulam və kənizlərin öz sahibləri ilə və uşaqların böyüklərlə necə rəftar etməsi gərəkdiyini bəyan edir)**.** (لِيَسْتَأْذِنْكُمُ الَّذِينَ مَلَكَتْ اَيْمَانُكُمْ وَالَّذِينَ لَمْ يَبْلُغُوا الْحُلُمَ مِنْكُمْ ثَلٰثَ مَرَّاتٍ) **– sahib olduğunuz** (qulam və kənizləriniz) **və həddi-büluğa çatmayan** (uşaqlarınız mənzillərinizə daxil olarkən) **bu 3 vaxtda, gərək, sizdən izin alsınlar.** (مِنْ قَبْلِ صَلٰوةِ الْفَجْرِ)**- sübh namazından qabaq,** (çünki o vaxt yuxudan durub paltar geyinmək zamanı olduğundan icazəsiz daxil olmaq münasib deyil)**,** (وَحِينَ تَضَعُونَ ثِيَابَكُمْ مِنَ الظَّهِيرَةِ) **– və günorta** (yatmaq üçün) **paltarınızı çıxartdıqda,** (وَمِنْ بَعْدِ صَلٰوةِ الْعِشَاءِ) **– bir də işa namazından sonra** (gecənin yarısında, yatmaq vaxtı olduğundan icazəsiz yanınıza daxil olmasınlar)**.** (ثَلٰثُ عَوْرَاتٍ لَكُمْ) **- bu 3 vaxt sizdən ötrü xəlvət vaxtıdır,** (ola bilər ki, bu vaxtlarda bədəniniz, ya da bəzi məhrəm yerləriniz açıq olsun. Örtünmək lazım olduğundan qeyd olunan şəxslər icazəsiz daxil ola bilməzlər. Bu icazəni almaq ancaq şəxsin qulamı, kənizi, bir də uşaqlarından ötrüdür, başqa şəxslər, ümumiyyətlə, o vaxtlar icazə də ala bilməzlər. Ancaq şəxsin öz arvadının icazə almasına ehtiyac yoxdur)**.** (لَيْسَ عَلَيْكُمْ وَلَا عَلَيْهِمْ جُنَاحٌ بَعْدَهُنَّ) **– nə sizə** (nə də qulam, kənizlərə və uşaqlara bu 3 vaxtdan) **sonra** (icazəsiz yanınıza daxil olmaqda) **bir günah yoxdur.** (طَوَّافُونَ عَلَيْكُمْ بَعْضُكُمْ عَلٰى بَعْضٍ) **– bu vaxtlardan sonra** (iş məqsədi ilə) **bir-birinizin yanına girib-çıxa bilərsiniz,** (كَذٰلِكَ يُبَيِّنُ اللّٰهُ لَكُمُ الْاٰيَاتِ) – (bu zikr olunan ayələr kimi) **Allah-Təala öz ayə və ehkamını sizdən ötrü belə bəyan edir.** (وَاللّٰهُ عَلِيمٌ حَكِيمٌ) **- Allah-Təala** (bəndələrinin faydasından) **agahdır və** (onlardan ötrü qanun verməkdə) **hikmət sahibidir.**

وَاللّٰهُ عَلِيمٌ حَكِيمٌ ﴿٥٩﴾ وَالْقَوَاعِدُ مِنَ النِّسَآءِ الّٰتِي لَا يَرْجُونَ نِكَاحًا فَلَيْسَ عَلَيْهِنَّ جُنَاحٌ اَنْ يَضَعْنَ
ثِيَابَهُنَّ غَيْرَ مُتَبَرِّجَاتٍ بِزِينَةٍ وَاَنْ يَسْتَعْفِفْنَ خَيْرٌ لَهُنَّ وَاللّٰهُ سَمِيعٌ عَلِيمٌ ﴿٦٠﴾ لَيْسَ عَلَى الْاَعْمٰى
حَرَجٌ وَلَا عَلَى الْاَعْرَجِ حَرَجٌ وَلَا عَلَى الْمَرِيضِ حَرَجٌ وَلَا عَلٰٓى اَنْفُسِكُمْ اَنْ تَأْكُلُوا مِنْ بُيُوتِكُمْ اَوْ
بُيُوتِ اٰبَآئِكُمْ اَوْ بُيُوتِ اُمَّهَاتِكُمْ اَوْ بُيُوتِ اِخْوَانِكُمْ اَوْ بُيُوتِ اَخَوَاتِكُمْ اَوْ بُيُوتِ اَعْمَامِكُمْ اَوْ بُيُوتِ
عَمَّاتِكُمْ اَوْ بُيُوتِ اَخْوَالِكُمْ اَوْ بُيُوتِ خَالَاتِكُمْ اَوْ مَا مَلَكْتُمْ مَفَاتِحَهُ اَوْ صَدِيقِكُمْ

---

**59)** (فَلْيَسْتَأْذِنُوا) (وَاِذَا بَلَغَ الْاَطْفَالُ مِنْكُمُ الْحُلُمَ) - **uşaqlar həddi-büluğa* çatdıqda** (كَمَا اسْتَأْذَنَ الَّذِينَ مِنْ قَبْلِهِمْ) – (onların da digər kişilər kimi izinsiz daxil olmağa ixtiyarları yoxdur, daxil olarkən) **əvvəlkilər kimi izin alıb** (daxil olsunlar)**.** (كَذٰلِكَ يُبَيِّنُ اللّٰهُ لَكُمْ اٰيَاتِهِ) - **Allah-Təala öz ayə və ehkamlarını sizdən ötrü belə bəyan edir.** (وَاللّٰهُ عَلِيمٌ حَكِيمٌ) - **Allah-Təala** (bəndələrinin faydasından) **agahdır və** (onlardan ötrü ehkam verməkdə) **hikmət sahibidir.**

*(****Qeyd:*** *İslam üləması arasında həddi-büluğa çatma yaşı mövzusunda ixtilaf vardır. İmam Əbu Hənifəyə görə oğlan 18 yaşında, qız 17 yaşında həddi-büluğa çatıb şəriət qarşısında məsul olar. Amma digər fəqihlər oğlan və qızda 15 yaşı həddi-büluğa çatma yaşı sayıblar. Amma imamiyyə üləması oğlanda 15 yaşı, qızda 9 yaşı həddi-büluğa çatma yaşı sayıblar. Belə olarsa, qızın işi çox müşkül olar).*

**60)** (وَالْقَوَاعِدُ مِنَ النِّسَاءِ الّٰتِي لَا يَرْجُونَ نِكَاحًا) – (heyzdən və doğuşdan kəsilib) **evlənməyə ümidi qalmayan qadınlara,** (فَلَيْسَ عَلَيْهِنَّ جُنَاحٌ اَنْ يَضَعْنَ ثِيَابَهُنَّ) – **üst libaslarını çıxarıb** (kişilərə görünməkdə) **heç bir günah yoxdur.** (غَيْرَ مُتَبَرِّجَاتٍ بِزِينَةٍ) – (məhrəm) **zinət yerlərini göstərməmək şərtilə** (olar)**,** (وَاَنْ يَسْتَعْفِفْنَ خَيْرٌ لَهُنَّ وَاللّٰهُ سَمِيعٌ عَلِيمٌ) - **amma iffət və ismətlə hərəkət edib** (naməhrəmlər arasında soyunmağı tərk etmələri) **onlar üçün daha yaxşıdır. Allah-Təala** (sizin hər bir sözünüzü) **eşidib,** (əməllərinizdən) **agahdır.** (Müsəlmanlar cihada gedərkən evlərində kor, çolaq və xəstə şəxsləri qoyub gedərdilər, amma onlar sahibləri, bəlkə, razı deyil deyə o şəxslərin evlərində olan yeməklərdən yeməzdilər, bu barədə növbəti ayə nazil oldu)**.**

**61)** (لَيْسَ عَلَى الْاَعْمٰى حَرَجٌ وَلَا عَلَى الْاَعْرَجِ حَرَجٌ وَلَا عَلَى الْمَرِيضِ حَرَجٌ) – **kor, çolaq və xəstələrə** (o evlərdə olan yeməklərdən yemələrində) **heç bir günah yoxdur.** (وَلَا عَلٰى اَنْفُسِكُمْ اَنْ تَأْكُلُوا مِنْ بُيُوتِكُمْ) - **və siz möminlərə də heç bir günah yoxdur ki, icazəsiz olaraq öz evlərinizdən** (oğullarınızın evlərindən) **yeyəsiniz,** (ata və oğul eyni sayıldığından, oğlun evi ataya isnad edilir)**.** (اَوْ بُيُوتِ اٰبَائِكُمْ) - **ya da atalarınızın** (və babalarınızın) **evlərindən yeyəsiniz,** (اَوْ بُيُوتِ اُمَّهَاتِكُمْ) - **ya da analarınızın** (nənələrinizin) **evlərindən yeyəsiniz.** (اَوْ بُيُوتِ اِخْوَانِكُمْ) - **ya da qardaşlarınızın evlərindən,** (اَوْ بُيُوتِ اَخَوَاتِكُمْ) - **ya da bacılarınızın evlərindən,** (اَوْ بُيُوتِ اَعْمَامِكُمْ) - **ya da əmilərinizin evlərindən,** (اَوْ بُيُوتِ عَمَّاتِكُمْ) - **ya da bibilərinizin evlərindən,** (اَوْ بُيُوتِ اَخْوَالِكُمْ) - **ya da dayılarını-**

لَيْسَ عَلَيْكُمْ جُنَاحٌ اَنْ تَأْكُلُوا جَمِيعًا اَوْ اَشْتَاتًاۜ فَاِذَا دَخَلْتُمْ بُيُوتًا فَسَلِّمُوا عَلٰٓى اَنْفُسِكُمْ تَحِيَّةً مِنْ عِنْدِ اللّٰهِ مُبَارَكَةً طَيِّبَةًۜ كَذٰلِكَ يُبَيِّنُ اللّٰهُ لَكُمُ الْاٰيَاتِ لَعَلَّكُمْ تَعْقِلُونَ۟ ﴿٦١﴾ اِنَّمَا الْمُؤْمِنُونَ الَّذٖينَ اٰمَنُوا بِاللّٰهِ وَرَسُولِهٖ

---

**zın evlərindən,** (اَوْ بُيُوتِ خَالَاتِكُمْ) **- ya da xalalarınızın evlərindən,** (اَوْ مَا مَلَكْتُمْ مَفَاتِحَهٗ) **- ya da açarları əlinizdə olan evlərdən** (nəzarət etdiyiniz evlərdən)**,** (اَوْ صَدٖيقِكُمْ)* **- ya da dostlarınızın evlərindən,**

*(*Qeyd: İmam Cəfər ibn Məhəmməd Sadiq buyurubdur: "Dostluq o qədər qiymətlidir ki, Allah-Təala onları ayədə övlad, ata, ana, bacı və qardaşla bir yerdə zikr edibdir. Həsən Bəsri öz evinə daxil olanda gördü ki, dostlarından bəzisi oturub yemək yeyir. Şadlıqdan üzü güldü. Dedi: "Hz. peyğəmbərin səhabələri də belə idi. Onlar bir-birilərinin evinə gedir, dostları evdə olmayanda kənizdən soruşardılar: "Onun dirhəmi, dinarı haradadır?" Kəniz göstərərdi, ona da nə qədər lazım olsaydı, götürüb gedərdi. Bu ittifaq və ittihad sayəsində islam ümməti tərəqqi tapıb aləmə sahib oldu. İki dostun arasında "isar" olmasa da, gərək, mütləq "müvasat" (özündə varkən möhtaca vermək) olsun. "İsar"- odur ki, özü möhtac olsa da, dostunu özündən üstün tutub malını ona versin, "müvasat" isə odur ki, əlində olan malı möhtac olan dostuna bağışlasın. Bu məsələ ilk müsəlmanlar arasında vacib hökmlərdən sayılırdı. Nəinki bu şəkildə hərəkət edirdilər, hətta aralarında kin, ədavət, nifaq olmayıb hamısı ittifaq içində islamı yaydılar. Bizim bu dövrdə isə tərsinədir, simurq quşu kimi yoxa çıxıbdır. Nəinki özündə olduğu halda verir, hətta səninlə dost da olsa, borc verməsini xahiş etsən, səndən elə üz döndərər ki, guya səninlə heç dost deyilmiş. Sənin ehtiyac içində olduğunu görən kimi dostluq əlaqəsini kəsib, yad adam kimi biganə olar. Arif bir şəxs başqa bir arifə şikayət edib dedi: "Mənim yanıma gəlib gedənlər çoxdur, mənə əziyyət verirlər. Mənə elə bir şey öyrət ki, onlardan xilas olum." O şəxs dedi: "Sənin yanına gələnlərdən hansı varlıdır, ondan borc istə, hansı yoxsuldur, ona da borc ver, başın sakit olar." O da onun sözünə əməl etdi, az bir zaman içində elə də oldu. Bu dövrün əhli isə necə də xəyanətkar, necə də hiyləbazdır. Eyni din və millətdən olan müsəlmanlar bir-birilərinə etibar etməyib, iki vəhşi heyvan kimi bir-birilərinə baxırlar. Bundan da pis şey varmı?)*

(Bu zikr olunan evlərdə olan yeməklərdən icazəsiz yemək caizdir)**.** (لَيْسَ عَلَيْكُمْ جُنَاحٌ اَنْ تَأْكُلُوا جَمٖيعًا اَوْ اَشْتَاتًا) – (qonaq çağırıldığınızda onlarla) **bir yerdə, ya da təklikdə yeməyinizdə sizə bir günah yoxdur,** (bəzi ərəb tayfalarında belə bir adət var idi, axşama kimi əgər onlara bir qonaq gəlməsəydi, tək yemək yeməyi xoşlamazdılar, bu barədə bu ayə nazil oldu)**.** (فَاِذَا دَخَلْتُمْ بُيُوتًا فَسَلِّمُوا عَلٰٓى اَنْفُسِكُمْ تَحِيَّةً مِنْ عِنْدِ اللّٰهِ مُبَارَكَةً طَيِّبَةً) – (bu zikr olunan) **evlərə** (ya da başqa bir evə) **daxil olduğunuzda özünüz kimi olan şəxslərə Allah-Təala yanından bərəkətli və pak olan bir salam verin,** (belə deyin: əs-səlamu aleykum və rəhmətullahi və bərəkatuhu)**.** (كَذٰلِكَ يُبَيِّنُ اللّٰهُ لَكُمُ الْاٰيَاتِ لَعَلَّكُمْ تَعْقِلُونَ) **- Allah-Təala öz ayə və ehkamlarını sizdən ötrü belə bəyan edir ki, bəlkə, ağılla düşünüb** (bu hökmlərin sirrini və həqiqətini anlayasınız. Boş bir evə, ya da məs-

وَاِذَا كَانُوا مَعَهُ عَلٰىٓ اَمْرٍ جَامِعٍ لَمْ يَذْهَبُوا حَتّٰى يَسْتَأْذِنُوهُۜ اِنَّ الَّذ۪ينَ يَسْتَأْذِنُونَكَ اُو۬لٰٓئِكَ الَّذ۪ينَ يُؤْمِنُونَ
بِاللّٰهِ وَرَسُولِه۪ۚ فَاِذَا اسْتَأْذَنُوكَ لِبَعْضِ شَأْنِهِمْ فَأْذَنْ لِمَنْ شِئْتَ مِنْهُمْ وَاسْتَغْفِرْ لَهُمُ اللّٰهَۜ اِنَّ اللّٰهَ غَفُورٌ
رَح۪يمٌ ﴿٦٢﴾ لَا تَجْعَلُوا دُعَٓاءَ الرَّسُولِ بَيْنَكُمْ كَدُعَٓاءِ بَعْضِكُمْ بَعْضًاۜ قَدْ يَعْلَمُ اللّٰهُ الَّذ۪ينَ يَتَسَلَّلُونَ
مِنْكُمْ لِوَاذًاۚ فَلْيَحْذَرِ الَّذ۪ينَ يُخَالِفُونَ عَنْ اَمْرِه۪ٓ اَنْ تُص۪يبَهُمْ فِتْنَةٌ اَوْ يُص۪يبَهُمْ عَذَابٌ اَل۪يمٌ ﴿٦٣﴾ اَلَٓا اِنَّ
لِلّٰهِ مَا فِي السَّمٰوَاتِ وَالْاَرْضِۜ قَدْ يَعْلَمُ مَٓا اَنْتُمْ عَلَيْهِۜ وَيَوْمَ يُرْجَعُونَ اِلَيْهِ فَيُنَبِّئُهُمْ بِمَا عَمِلُواۜ

---

cidə daxil olduqda da, gərək, belə salam verilsin – əs-səlamu aleynə və alə ibadullahis-salihin, ondan sonra daxil olmaq olar)**.**

**62)** (اِنَّمَا الْمُؤْمِنُونَ الَّذ۪ينَ اٰمَنُوا بِاللّٰهِ وَرَسُولِه۪) **- həqiqətən, möminlər o şəxslərdir ki, Allah-Təalaya və onun peyğəmbəri** (Məhəmmədə) **iman gətirirlər.** (وَاِذَا كَانُوا مَعَهُ عَلٰى اَمْرٍ جَامِعٍ لَمْ يَذْهَبُوا حَتّٰى يَسْتَأْذِنُوهُ) – (o möminlərin xüsusiyyəti budur:) **hər hansı bir işdən ötrü** (peyğəmbərlə) **bir yerdə olduqlarında,** (peyğəmbərdən) **izin almamış getməzlər.** (Yəni peyğəmbərdən izin almamış heç kim onun yanından getməsin)**.** (اِنَّ الَّذ۪ينَ يَسْتَأْذِنُونَكَ اُو۬لٰٓئِكَ الَّذ۪ينَ يُؤْمِنُونَ بِاللّٰهِ وَرَسُولِه۪) **-** (ey Məhəmməd)**, həqiqətən, o şəxslər ki səndən izin alıb** (elə gedir)**, Allah-Təalaya və onun peyğəmbərinə iman gətirənlər onlardır.** (فَاِذَا اسْتَأْذَنُوكَ لِبَعْضِ شَأْنِهِمْ) **-** (ey Məhəmməd)**, bəzi işlərindən ötrü səndən izin istədiklərində,** (فَأْذَنْ لِمَنْ شِئْتَ مِنْهُمْ)**– onlardan istədiyinə** (getməsi üçün izin ver, istəmədiyinə izin vermə)**.** (وَاسْتَغْفِرْ لَهُمُ اللّٰهَ اِنَّ اللّٰهَ غَفُورٌ رَح۪يمٌ) – (izin alıb gedənlərdən ötrü) **Allahdan bağışlanma dilə.** (Amma onların sənin məclisindən ayrılmamaları izin alıb getmələrindən yaxşıdır)**, həqiqətən, Allah-Təala** (belələrini) **bağışlayıb rəhm edəndir.**

**63)** (لَا تَجْعَلُوا دُعَٓاءَ الرَّسُولِ بَيْنَكُمْ كَدُعَٓاءِ بَعْضِكُمْ بَعْضًا) **-(Hz. Peyğəmbərin sizə ehtiyacı olub sizi çağırdıqda, dəvətini qəbul edib, onun yanına gedin. Peyğəmbərin çağırmasını öz aranızda bir-birinizi çağırmaqla eyni tutub** (müqayisə etməyin və ya onu özünüzü çağırdığınız kimi çağırmayın, özgə şəxs sizi çağıranda getməsəniz də olar, amma peyğəmbər çağıranda, gərək, itaət edib hüzuruna gedəsiniz)**.** (قَدْ يَعْلَمُ اللّٰهُ الَّذ۪ينَ يَتَسَلَّلُونَ مِنْكُمْ لِوَاذًا) **- həqiqətən, Allah-Təala sizlərdən** (peyğəmbərin məclisindən) **xəlvətcə çıxıb gedənlərdən agahdır,** (bəzi münafiqlər peyğəmbərdən izin almamış gedərdilər)**.** (فَلْيَحْذَرِ الَّذ۪ينَ يُخَالِفُونَ عَنْ اَمْرِه۪ٓ) **- əlbəttə,** (peyğəmbərin əmrinə) **müxalif olanlar, gərək,** (bundan) **qorxsunlar,** (اَنْ تُص۪يبَهُمْ فِتْنَةٌ) – (bu dünyada) **bəla və müsibətə düçar olmaqdan qorxsunlar.** (اَوْ يُص۪يبَهُمْ عَذَابٌ اَل۪يمٌ) **- ya da** (qiyamət günü) **şiddətli əzaba düçar olmaqdan** (qorxsunlar)**.**

**64)** (اَلَٓا اِنَّ لِلّٰهِ مَا فِي السَّمٰوَاتِ وَالْاَرْضِ) **-** (ey Məhəmməd)**, xəbərdar ol ki, həqiqətən, səmaların və yerdə olanların** (hakimiyyəti və idarəsi) **Allah-Təalaya məxsusdur.** (Heç bir şey ona məxfi qalmaz. Necə ola bilər ki, peyğəmbərin

وَاللّٰهُ بِكُلِّ شَيْءٍ عَلِيمٌ ﴿٦٤﴾

---

məclisindən gizlin gedən münafiqlərdən agah olmasın?) (قَدْ يَعْلَمُ مَا اَنْتُمْ عَلَيْهِ) **- həqiqətən, Allah-Təala hansı halda** (mömin, yoxsa münafiq) **olduğunuzdan agahdır.** (وَيَوْمَ يُرْجَعُونَ اِلَيْهِ) **- və Allah-Təalanın tərəfinə qayıdacağınız gündən də agahdır.** (فَيُنَبِّئُهُمْ بِمَا عَمِلُوا) – (Allah-Təala o gün münafiqlərə) **etdikləri əməllərin hamısını xəbər verəcəkdir.** (وَاللّٰهُ بِكُلِّ شَيْءٍ عَلِيمٌ) **- Allah-Təala hər bir şeydən agahdır,** (elmindən heç bir şey kənar deyil)**.**

Allah həmd olsun, Nur surəsinin təfsiri bitdi, Allah-Təalanın hökmlərini, qadağalarını, iffət və ismətə dair əmrlərini ehtiva edən bir surədir. Bu mübarək surənin uca məzmunundan agah olub onun ədəbi ilə ədəblənənlər nə xoşbəxtdir. Hz. peyğəmbər buyurubdur: *"Kim Nur surəsini oxusa, Allah-Təala ona 10 savab bəxş edər."* (Qazi Beyzavi, Ənvarut-Tənzil, IV/462)



# əl-FURQAN SURƏSİ

25-ci surədir. Məkkədə nazil olub, 77 ayə, 892 kəlmə, 3783 hərfdir.



بِسْمِ اللّٰهِ الرَّحْمٰنِ الرَّحِيمِ. تَبَارَكَ الَّذ۪ي نَزَّلَ الْفُرْقَانَ عَلٰى عَبْدِه۪ لِيَكُونَ لِلْعَالَم۪ينَ نَذ۪يرًاۙ ﴿١﴾ اَلَّذ۪ي لَهُ مُلْكُ السَّمٰوَاتِ وَالْاَرْضِ وَلَمْ يَتَّخِذْ وَلَدًا وَلَمْ يَكُنْ لَهُ شَر۪يكٌ فِي الْمُلْكِ وَخَلَقَ كُلَّ شَيْءٍ فَقَدَّرَهُ تَقْد۪يرًا ﴿٢﴾ وَاتَّخَذُوا مِنْ دُونِه۪ٓ اٰلِهَةً لَا يَخْلُقُونَ شَيْـًٔا وَهُمْ يُخْلَقُونَ

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1)** (تَبَارَكَ الَّذ۪ي نَزَّلَ الْفُرْقَانَ عَلٰى عَبْدِه۪) – (xeyir və bərəkəti çox olan, sifət və feillərində) **hər şeydən uca olan Allah-Təala haqla batili ayıran Quranı öz qulu** (Məhəmmədə) **nazil etdi.** (لِيَكُونَ لِلْعَالَم۪ينَ نَذ۪يرًا) **- belə ki,** (o Quran qiyamətə kimi) **hər bir aləmdə olan** (məxluqu Allah-Təalanın əzabı ilə) **qorxudan** (və haqq tərəfinə* hidayət edən olsun)**.**

*(*__Qeyd:__ Qurani-Şərif qiyamətə kimi insanların arasında olub onları uca səslə Allah-Təalaya tərəf dəvət edəndir. Qurani-Şərifi Allah-Təaladan gətirib insanlara çatdıran Hz. Peyğəmbər Məhəmməd ibn Abdullah (ə.s), özü dünya evi ilə vidalaşıb, Allah-Təalanın əmri ilə Haqqın hüzuruna, ruhlar diyarına köçdü. Amma Qurani-Şərif hər zaman diri olub qiyamətə kimi insanları dəvətə davam edib əbədi bir möcüzə və şəfa verən kafi bir kitabdır. Qurani-Şərifin incəliklərindən və öyüd-nəsihətlərindən agah olub, onlardan nəticə çıxarıb əməl etmək fəzilətli şəxslərdən ötrü böyük səadətdir. Qurani-Şərif şəriət və siyasət ehkamlarını ehtiva etdiyindən bütün səmavi kitablardan üstün olub hamısına rəhbər təyin edilibdir. Bütün ərəb ədibləri və fəsihləri Qurani-Şərifin ta qiyamətə kimi insanların din işlərinə kafi bir kitab olduğunu iqrar edib qəbul ediblər. Amma müsəlmanların əksəriyyəti Qurani-Şərifin ehkamından üz döndərib öz başçılarının xurafat və uydurmalarına tabe olub özlərindən ötrü Qurani-Şərifdən ayrı bir din seçiblər. İlahi, müsəlmanlara bəsirət, islama yardım bəxş et, amin!)*

**2)** (اَلَّذ۪ي لَهُ مُلْكُ السَّمٰوَاتِ وَالْاَرْضِ) – (Allah-Təalanın sifətlərindən biri) **odur ki, səmaların və yerin hakimiyyəti ona məxsusdur.** (وَلَمْ يَتَّخِذْ وَلَدًا)**-özünə övlad götürməyibdir.** (وَلَمْ يَكُنْ لَهُ شَر۪يكٌ فِي الْمُلْكِ) – **hakimiyyətində heç bir şəriki yoxdur.** (وَخَلَقَ كُلَّ شَيْءٍ فَقَدَّرَهُ تَقْد۪يرًا) **- hər bir şeyi yaradıb, onu təqdir** (müəyyən) **edib,** (nöqsandan xali edibdir)**.**

**3)** (وَاتَّخَذُوا مِنْ دُونِه۪ٓ اٰلِهَةً) – (amma insanlar Allah-Təalaya zülm edib) **başqa məbudlar qəbul edib** (Ona şərik qoşublar)**.** (لَا يَخْلُقُونَ شَيْـًٔا وَهُمْ يُخْلَقُونَ) **- halbuki Allah-Təalaya şərik qoşulan bu məbudların heç bir şeyi yaratma-**

وَلَا يَمْلِكُونَ لِاَنْفُسِهِمْ ضَرًّا وَلَا نَفْعًا وَلَا يَمْلِكُونَ مَوْتًا وَلَا حَيٰوةً وَلَا نُشُورًا ﴿٣﴾ وَقَالَ الَّذِينَ
كَفَرُوٓا اِنْ هٰذَآ اِلَّآ اِفْكٌ افْتَرٰيهُ وَاَعَانَهُ عَلَيْهِ قَوْمٌ اٰخَرُونَۚ فَقَدْ جَٓاؤُ ظُلْمًا وَزُورًاۚ ﴿٤﴾ وَقَالُوٓا اَسَاطِيرُ
الْاَوَّلِينَ اكْتَتَبَهَا فَهِيَ تُمْلٰى عَلَيْهِ بُكْرَةً وَاَصِيلًا ﴿٥﴾ قُلْ اَنْزَلَهُ الَّذِي يَعْلَمُ السِّرَّ فِي السَّمٰوَاتِ
وَالْاَرْضِ اِنَّهُ كَانَ غَفُورًا رَحِيمًا ﴿٦﴾ وَقَالُوا مَالِ هٰذَا الرَّسُولِ يَأْكُلُ الطَّعَامَ وَيَمْشِي فِي الْاَسْوَاقِ
لَوْلَٓا اُنْزِلَ اِلَيْهِ مَلَكٌ فَيَكُونَ مَعَهُ نَذِيرًاۙ ﴿٧﴾

---

**ğa qüdrətləri olmayıb, özləri də Allah-Təala tərəfindən yaradılıblar.** (وَلَا يَمْلِكُونَ لِاَنْفُسِهِمْ ضَرًّا وَلَا نَفْعًا) **– özlərinə bir zərər və mənfəət verməyə də malik deyillər.** (Belə bir halda, başqalarına necə zərər və mənfəət verə bilərlər?) (وَلَا يَمْلِكُونَ مَوْتًا وَلَا حَيٰوةً وَلَا نُشُورًا) **- öldürüb diriltməyə,** (qiyamət günündə) **cəm etməyə heç vaxt qadir ola bilməzlər.** (Aqil şəxs də belə şeylərə ibadət edərmi?)

**4)** (وَقَالَ الَّذِينَ كَفَرُوا اِنْ هٰذَآ اِلَّآ اِفْكٌ افْتَرٰيهُ) **- kafir olanlar** (Məkkədə Qüreyş camaatından Nəzr ibn Haris və ona tabe olanlar) **dedilər: "Bu** (Quran) **ancaq** (Məhəmməd tərəfindən) **uydurulan bir yalandır,** (Allah-Təalaya isnad edibdir). (وَاَعَانَهُ عَلَيْهِ قَوْمٌ اٰخَرُونَ) **- başqa bir qövm də** (bu yalanda) **ona kömək edibdir,** (فَقَدْ جَٓاؤُ ظُلْمًا وَزُورًا) **-** (ey Məhəmməd)**, həqiqətən, bu şəxslər zülm və böhtana yuvarlanıb** (Allah-Təalanın kəlamını yalan sayıb qəbul etmədilər)**.**

**5)** (وَقَالُوٓا اَسَاطِيرُ الْاَوَّلِينَ اكْتَتَبَهَا) – (yenə Məkkə müşriklərinin bəzisi) **dedi:** (bu Quran ayələri) **əvvəlki** (ümmətlərin) **əfsanələridir,** (Məhəmməd özü yazıb-oxuya bilmədiyindən) **özündən ötrü yazdırıbdır,** (فَهِيَ تُمْلٰى عَلَيْهِ بُكْرَةً وَاَصِيلًا) **– səhər-axşam bu** (ayələr gizlincə) **ona oxunur,** (sonra da gəlib bizə deyir ki, bu ayələr Allah-Təaladandır. Məkkədə iki bizanslı var idi, deyirdilər: "Məhəmməd Quranı onlardan öyrənir")**,**

**6)** (قُلْ اَنْزَلَهُ الَّذِي يَعْلَمُ السِّرَّ فِي السَّمٰوَاتِ وَالْاَرْضِ) – (ey Məhəmməd, müşriklərə) **de ki,** (elə deyil, bu Quranı) **səmalarda və yerdə hər bir gizlin şeydən agah olan Allah-Təala nazil edibdir.** (اِنَّهُ كَانَ غَفُورًا رَحِيمًا) – (tövbə edib Allah-Təalaya dönüb, Quranı qəbul edin)**, həqiqətən, Allah-Təala bəndələrinə rəhm edib onların günahlarını bağışlayandır.**

**7)** (وَقَالُوا مَالِ هٰذَا الرَّسُولِ يَأْكُلُ الطَّعَامَ وَيَمْشِي فِي الْاَسْوَاقِ) **- Qüreyş müşrikləri dedilər: əgər bu** (Məhəmməd) **peyğəmbərdirsə, niyə** (bizim kimi hərəkət edib) **yemək yeyir, bazarlarda alış-veriş edir?** (Əgər peyğəmbər olsaydı, gərək, mələk olub insani xüsusiyyətdə olmayaydı)**.** لَوْلَٓا اُنْزِلَ اِلَيْهِ مَلَكٌ فَيَكُونَ مَعَهُ (نَذِيرًا) – (özü mələk olmasa da)**, özü ilə birlikdə qorxudan bir mələk nazil olub,** (ona kömək etməli deyildimi, belə ki, Məhəmmədin peyğəmbər olduğu məlum olsun?)

اَوْ يُلْقٰى اِلَيْهِ كَنْزٌ اَوْ تَكُونُ لَهُ جَنَّةٌ يَأْكُلُ مِنْهَاۜ وَقَالَ الظَّالِمُونَ اِنْ تَتَّبِعُونَ اِلَّا رَجُلًا مَسْحُورًا ﴿٨﴾
اُنْظُرْ كَيْفَ ضَرَبُوا لَكَ الْاَمْثَالَ فَضَلُّوا فَلَا يَسْتَطِيعُونَ سَبِيلًا ﴿٩﴾ تَبَارَكَ الَّذٖٓي اِنْ شَٓاءَ جَعَلَ لَكَ
خَيْرًا مِنْ ذٰلِكَ جَنَّاتٍ تَجْرٖي مِنْ تَحْتِهَا الْاَنْهَارُۙ وَيَجْعَلْ لَكَ قُصُورًا ﴿١٠﴾ بَلْ كَذَّبُوا بِالسَّاعَةِ
وَاَعْتَدْنَا لِمَنْ كَذَّبَ بِالسَّاعَةِ سَعٖيرًاۚ ﴿١١﴾ اِذَا رَاَتْهُمْ مِنْ مَكَانٍ بَعٖيدٍ سَمِعُوا لَهَا تَغَيُّظًا وَزَفٖيرًا
﴿١٢﴾ وَاِذَٓا اُلْقُوا مِنْهَا مَكَانًا ضَيِّقًا مُقَرَّنٖينَ دَعَوْا هُنَالِكَ ثُبُورًاۜ ﴿١٣﴾

---

**8)** (اَوْ يُلْقٰى اِلَيْهِ كَنْزٌ) – (bir halda ki, mələk deyil, bir mələk də ona kömək etmir, səmadan) **ona bir xəzinə endirilməli deyildimi,** (belə ki, onunla dolanıb işləməyə ehtiyacı olmasın?) (اَوْ تَكُونُ لَهُ جَنَّةٌ يَأْكُلُ مِنْهَا) **- ya da bir bağı olsun, o bağdan yeyib"** (dolansın? Bir halda ki, bunların heç biri onda yoxdur, demək o, peyğəmbər deyil. Fasiqlər nə qədər ağılsız və insafsız imişlər ki, Hz. Peyğəmbərin işləməyini ona irad tuturdular? Halbuki insanlığın ilk şərti işləyib başqasına möhtac olmamaqdır)**.** (وَقَالَ الظَّالِمُونَ اِنْ تَتَّبِعُونَ اِلَّا رَجُلًا مَسْحُورًا) **- zalım olan** (müşriklər möminlərə) **deyirlər: "Siz ancaq sehrlənmiş** (ağlını itirmiş) **bir kişiyə tabe olursunuz."**

**9)** (اُنْظُرْ كَيْفَ ضَرَبُوا لَكَ الْاَمْثَالَ فَضَلُّوا) **-** (ey Məhəmməd)**, bax gör** (bu müşriklər) **səndən ötrü necə məsəllər çəkib** (isnad edirlər. Gah deyirlər: "Peyğəmbər, gərək, mələk olsun", gah deyirlər: "Peyğəmbərlik insanla mələk arasında müştərək olmalıdır", gah da deyirlər: "Gərək, bir xəzinəsi, ya da bir bağı olsun", gah da sənə sehrbaz, şair və ya dəli deyib) **zəlalətə düşdülər.** (فَلَا يَسْتَطِيعُونَ سَبِيلًا) **- bir yol da tapmırlar** (ki, bir söz deyib iddialarını isbat etsinlər)**.**

**10)** (تَبَارَكَ الَّذٖٓي اِنْ شَٓاءَ جَعَلَ لَكَ خَيْرًا مِنْ ذٰلِكَ جَنَّاتٍ تَجْرٖي مِنْ تَحْتِهَا الْاَنْهَارُ) **- Allah-Təalanın xeyir və bərəkəti çoxdur, əgər istəsə, onların dediyindən də yaxşısını,** (ağaclarının) **altından çaylar axan cənnətləri sənə** (bu dünyada) **bəxş edər.** (وَيَجْعَلْ لَكَ قُصُورًا) **-və sənə qəsrlər verər.** (Lakin Allah-Təala öz hikməti sayəsində hər kəsin güzəranını öz qazancına həvalə edibdir. Peyğəmbər də olsa, gərək, hər şəxs özü özünü dolandırsın)**.**

**11)** (بَلْ كَذَّبُوا بِالسَّاعَةِ) **- bəlkə** (bu müşriklər) **qiyamət gününü də təkzib edib** (qiyamət olmayacaq deyirlər)**.** (وَاَعْتَدْنَا لِمَنْ كَذَّبَ بِالسَّاعَةِ سَعٖيرًا) **– biz də qiyamət gününü təkzib edənlərdən ötrü şiddətli** (cəhənnəm) **odunu hazır etmişik.**

**12)** (اِذَا رَاَتْهُمْ مِنْ مَكَانٍ بَعٖيدٍ) – (qiyamət günündə cəhənnəm müşrikləri) **uzaqdan gördükdə,** (سَمِعُوا لَهَا تَغَيُّظًا وَزَفٖيرًا) – (o müşriklər cəhənnəmin) **şiddətli səsini və** (qəzəbli şəxslər kimi) **qəzəblə qaynamasını eşidərlər.**

**13)** (وَاِذَٓا اُلْقُوا مِنْهَا مَكَانًا ضَيِّقًا مُقَرَّنٖينَ) **- əlləri boyunlarına zəncirlə bağlı olduğu halda** (cəhənnəmin) **dar bir yerinə atıldıqları zaman,** (دَعَوْا هُنَالِكَ ثُبُورًا) – (müşriklər özlərinə) **ölüm diləyərlər.**

لَا تَدْعُوا الْيَوْمَ ثُبُورًا وَاحِدًا وَادْعُوا ثُبُورًا كَثِيرًا ﴿١٤﴾ قُلْ اَذٰلِكَ خَيْرٌ اَمْ جَنَّةُ الْخُلْدِ الَّتِي وُعِدَ الْمُتَّقُونَ ۜ كَانَتْ لَهُمْ جَزَٓاءً وَمَصِيرًا ﴿١٥﴾ لَهُمْ فِيهَا مَا يَشَٓاؤُنَ خَالِدِينَ ۜ كَانَ عَلٰى رَبِّكَ وَعْدًا مَسْؤُلًا ﴿١٦﴾ وَيَوْمَ يَحْشُرُهُمْ وَمَا يَعْبُدُونَ مِنْ دُونِ اللّٰهِ فَيَقُولُ ءَاَنْتُمْ اَضْلَلْتُمْ عِبَادِي هٰٓؤُلَٓاءِ اَمْ هُمْ ضَلُّوا السَّبِيلَ ۜ﴿١٧﴾ قَالُوا سُبْحَانَكَ مَا كَانَ يَنْبَغِي لَنَٓا اَنْ نَتَّخِذَ مِنْ دُونِكَ مِنْ اَوْلِيَٓاءَ وَلٰكِنْ مَتَّعْتَهُمْ وَاٰبَٓاءَهُمْ حَتّٰى نَسُوا الذِّكْرَ ۚ وَكَانُوا قَوْمًا بُورًا ﴿١٨﴾ فَقَدْ كَذَّبُوكُمْ بِمَا تَقُولُونَ ۙ فَمَا تَسْتَطِيعُونَ صَرْفًا وَلَا نَصْرًاۚ

---

**14)** (لَا تَدْعُوا الْيَوْمَ ثُبُورًا وَاحِدًا وَادْعُوا ثُبُورًا كَثِيرًا) – (Allah-Təala tərəfindən onlara deyilər: Cəhənnəmdə müxtəlif əzablara düçar olacağınızdan sizdən ötrü birdəfəlik ölüm yoxdur, ölüb əzabdan qurtulmaq yoxdur”)**, bu gün özünüzə bir ölüm diləməyin, çox ölümlər diləyin.**

**15)** (قُلْ اَذٰلِكَ خَيْرٌ اَمْ جَنَّةُ الْخُلْدِ الَّتِي وُعِدَ الْمُتَّقُونَ) - (ey Məhəmməd, müşriklərə) **de ki, bu** (zikr olunan əzablar yaxşıdır)**, yoxsa** (Allah-Təala tərəfindən) **müttəqilərə vəd edilən əbədi cənnət?** (كَانَتْ لَهُمْ جَزَٓاءً وَمَصِيرًا) – (o cənnət) **onların** (əməllərinin) **mükafatı və son qayıdış yerləridir.**

**16)** (لَهُمْ فِيهَا مَا يَشَٓاؤُنَ خَالِدِينَ) – (müttəqilərdən ötrü o cənnətdə) **əbədi qalmaq üzrə istədikləri hər şey mövcuddur,** (كَانَ عَلٰى رَبِّكَ وَعْدًا مَسْؤُلًا) – (müttəqilərin cənnətdə istədiyi şeylər) **Allah-Təalanın üzərinə vacib olan və ondan istənilən bir vəddir,** (gərək, vədinə sadiq olsun)**.**

**17)** (وَيَوْمَ يَحْشُرُهُمْ وَمَا يَعْبُدُونَ مِنْ دُونِ اللّٰهِ) – **o gün** (qiyamət günü Allah-Təala müşrikləri) **və** (onların) **Allah-Təaladan başqa ibadət etdikləri** (məbudlarını) **bir yerə cəm edər.** (فَيَقُولُ ءَاَنْتُمْ اَضْلَلْتُمْ عِبَادِي هٰٓؤُلَٓاءِ اَمْ هُمْ ضَلُّوا السَّبِيلَ) – (Allah-Təala xitab edib müşriklərin məbudlarına) **deyər: “Bəs siz mənim bu bəndələrimi zəlalətə salıb** (haqdan kənar etdiniz)**, yoxsa onlar özləri** (haqq) **yolundan kənara düşdülər?”**

**18)** (قَالُوا سُبْحَانَكَ مَا كَانَ يَنْبَغِي لَنَٓا اَنْ نَتَّخِذَ مِنْ دُونِكَ مِنْ اَوْلِيَٓاءَ) – (məbudlar) **deyər: “**(İlahi, hər bir eyibdən) **pak və müqəddəssən, bizdən ötrü heç vaxt caiz deyil ki, səndən başqa özümüzə dostlar tutaq.** (وَلٰكِنْ مَتَّعْتَهُمْ وَاٰبَٓاءَهُمْ حَتّٰى نَسُوا الذِّكْرَ) **- lakin sən onlara** (və ata-babalarına o qədər uzun ömür və) **nemət verdin ki, onlar da** (məğrur olub) **səni zikr etməyi,** (iman gətirməyi) **unudub,** (sənə şərik qoşdular)**.** (وَكَانُوا قَوْمًا بُورًا) – (sənə şərik qoşduqları üçün əzabın onları tutub) **həlak olan bir qövm oldular.”**

**19)** (فَقَدْ كَذَّبُوكُمْ بِمَا تَقُولُونَ) – (ondan sonra Allah-Təala müşriklərə xitab edib buyurur: “Ey müşriklər, deyirdiniz ki, bunlar sizin məbudlardır”)**, lakin onlar sizin dediklərinizi təkzib edib** (məbudluqlarını inkar etdilər)**.** (فَمَا تَسْتَطِيعُونَ صَرْفًا وَلَا نَصْرًا) **- indi** (bugünkü gündə) **nə əzabı** (özünüzdən) **qaytara bilərsiniz**

وَمَنْ يَظْلِمْ مِنْكُمْ نُذِقْهُ عَذَابًا كَبِيرًا ﴿١٩﴾ وَمَٓا اَرْسَلْنَا قَبْلَكَ مِنَ الْمُرْسَلِينَ اِلَّٓا اِنَّهُمْ لَيَأْكُلُونَ الطَّعَامَ
وَيَمْشُونَ فِي الْاَسْوَاقِۜ وَجَعَلْنَا بَعْضَكُمْ لِبَعْضٍ فِتْنَةًۜ اَتَصْبِرُونَۚ وَكَانَ رَبُّكَ بَصِيرًا ﴿٢٠﴾ وَقَالَ الَّذِينَ
لَا يَرْجُونَ لِقَٓاءَنَا لَوْلَٓا اُنْزِلَ عَلَيْنَا الْمَلٰٓئِكَةُ اَوْ نَرٰى رَبَّنَاۜ لَقَدِ اسْتَكْبَرُوا فٖٓي اَنْفُسِهِمْ وَعَتَوْ عُتُوًّا كَبِيرًا
﴿٢١﴾ يَوْمَ يَرَوْنَ الْمَلٰٓئِكَةَ لَا بُشْرٰى يَوْمَئِذٍ لِلْمُجْرِمِينَ وَيَقُولُونَ حِجْرًا مَحْجُورًا ﴿٢٢﴾ وَقَدِمْنَٓا اِلٰى مَا
عَمِلُوا مِنْ عَمَلٍ فَجَعَلْنَاهُ هَبَٓاءً مَنْثُورًا ﴿٢٣﴾

---

**nə də özünüzə bir kömək tapmağa qadir olmazsınız.** (وَمَنْ يَظْلِمْ مِنْكُمْ نُذِقْهُ عَذَابًا كَبِيرًا) – (bu zalım müşriklərə vəd edilən əzabları eşitdiniz) **və sizdən də kim zülm etsə, ona da** (müşriklər kimi) **böyük** (cəhənnəm) **əzabını dadızdıracağıq.** (O əzabdan xilas olmayacaqdır)**.**

**20)** (وَمَٓا اَرْسَلْنَا قَبْلَكَ مِنَ الْمُرْسَلِينَ اِلَّٓا اِنَّهُمْ لَيَأْكُلُونَ الطَّعَامَ وَيَمْشُونَ فِي الْاَسْوَاقِ) – (ey Məhəmməd)**, səndən qabaq elə bir peyğəmbər göndərmədik ki,** (onlar da sənin kimi) **yemək yeyib bazarlarda gəzib dolaşmasınlar.** (Sən ilk peyğəmbər deyilsən ki, , insandan peyğəmbər gəlməsi camaata ağır gəlsin)**.** (وَجَعَلْنَا بَعْضَكُمْ لِبَعْضٍ فِتْنَةً) – **sizin bəzinizi digərlərindən ötrü bəla, möhnət etdik,** (Ey Məhəmməd, bu müşrikləri səndən və möminlərdən ötrü bəla və möhnət etdik ki,) (اَتَصْبِرُونَ وَكَانَ رَبُّكَ بَصِيرًا) – **görək siz bu müşriklərin bəla və möhnətlərinə səbir edib dözə bilirsinizmi?** (Ta ki Allah-Təala o səbirdən sonra sizə nicat versin. Əlbəttə, gərək, səbir edəsiniz. Ey Məhəmməd)**, sənin rəbbin Allah-Təala** (səbir edənlərin və zalımların əhvalını) **görəndir,** (bu müşriklərə görə qəlbin sıxılmasın. Sənin bu səbir etməyində sənin özün və ümmətindən ötrü səadət vardır)**.**

**21)** (وَقَالَ الَّذِينَ لَا يَرْجُونَ لِقَٓاءَنَا لَوْلَٓا اُنْزِلَ عَلَيْنَا الْمَلٰٓئِكَةُ اَوْ نَرٰى رَبَّنَا) – (axirət günündə) **bizimlə** (savab və əzabımızla) **qarşılaşmağı ümid etməyənlər dedilər: "Niyə bizə mələklər nazil olub** (Məhəmmədin doğruluğunu xəbər vermir?)**, ya da gərək, rəbbimiz Allah-Təalanı görək** (ki, onun əmri ilə Məhəmmədə inanaq)**.** (لَقَدِ اسْتَكْبَرُوا فٖٓي اَنْفُسِهِمْ) – (ey Məhəmməd, həqiqətən, müşriklər bu sözləri deməklə) **özləri haqqında təkəbbürlənib,** (küfr və inadları qəlblərinə yayılıbdır)**.** (وَعَتَوْ عُتُوًّا كَبِيرًا) – **və zalımlıqda həddi aşıb** (Musanın qövmü kimi Allah-Təalanı görmək istəyirlər)**.**

**22)** (يَوْمَ يَرَوْنَ الْمَلٰٓئِكَةَ لَا بُشْرٰى يَوْمَئِذٍ لِلْمُجْرِمِينَ) – (ey Məhəmməd, bu müşriklər qiyamət) **günü** (əzab) **mələklərini gördükdə, o gün günahkarlardan ötrü** (Allah-Təaladan heç bir xeyir) **müjdə olmaz,** (ancaq əzab müjdəsi verilər)**.** (وَيَقُولُونَ حِجْرًا مَحْجُورًا) – (o vaxt da müşriklər qorxularından) **deyərlər:** (ey rəbbimiz, bu əzabı bizdən) **çox uzaqlaşdır** (ta ki bir də geri qayıtmasın)**.**

**23)** (وَقَدِمْنَٓا اِلٰى مَا عَمِلُوا مِنْ عَمَلٍ فَجَعَلْنَاهُ هَبَٓاءً مَنْثُورًا) – (ey Məhəmməd, müşriklər dünyadakı xeyir əməllərinə - qohum-əqrəbaya, məzluma kömək edib qonaq

اَصْحَابُ الْجَنَّةِ يَوْمَئِذٍ خَيْرٌ مُسْتَقَرًّا وَاَحْسَنُ مَقِيلًا ﴿٢٤﴾ وَيَوْمَ تَشَقَّقُ السَّمَٓاءُ بِالْغَمَامِ وَنُزِّلَ الْمَلٰٓئِكَةُ تَنْزِيلًا ﴿٢٥﴾ اَلْمُلْكُ يَوْمَئِذٍ الْحَقُّ لِلرَّحْمٰنِۜ وَكَانَ يَوْمًا عَلَى الْكَافِرِينَ عَسِيرًا ﴿٢٦﴾ وَيَوْمَ يَعَضُّ الظَّالِمُ عَلٰى يَدَيْهِ يَقُولُ يَا لَيْتَنِي اتَّخَذْتُ مَعَ الرَّسُولِ سَبِيلًا ﴿٢٧﴾ يَا وَيْلَتٰى لَيْتَنِي لَمْ اَتَّخِذْ فُلَانًا خَلِيلًا ﴿٢٨﴾ لَقَدْ اَضَلَّنِي عَنِ الذِّكْرِ بَعْدَ اِذْ جَٓاءَنِيۜ وَكَانَ الشَّيْطَانُ لِلْاِنْسَانِ خَذُولًا ﴿٢٩﴾ وَقَالَ الرَّسُولُ يَا رَبِّ اِنَّ قَوْمِي اتَّخَذُوا هٰذَا الْقُرْاٰنَ مَهْجُورًا ﴿٣٠﴾ وَكَذٰلِكَ جَعَلْنَا لِكُلِّ نَبِيٍّ عَدُوًّا مِنَ الْمُجْرِمِينَۜ

---

saxlamaq kimi əməllərə ümidvar olublar). **Biz isə onların etdiyi o əməlləri** (toz və ya şüa) **zərrələri kimi dağınıq edərik.** (Allah-Təala qiyamət günündə müşriklərin xeyir əməllərini puç edəcəyini vəd edir, bir sultan ona asi olan camaata hücum edib onları zəlil etdiyi kimi, Allah da müşrikləri elə zəlil edəcək)**.**

**24)** (اَصْحَابُ الْجَنَّةِ يَوْمَئِذٍ خَيْرٌ مُسْتَقَرًّا وَاَحْسَنُ مَقِيلًا) – (axirət) **günündə cənnət əhlinin qalacağı yer yaxşıdır, amma istirahət məskənləri daha gözəldir.**

**25)** (وَيَوْمَ تَشَقَّقُ السَّمَاءُ بِالْغَمَامِ وَنُزِّلَ الْمَلٰٓئِكَةُ تَنْزِيلًا) – (qiyamət günü) **elə bir gündür ki, buludların səbəbinə səma parçalanar və** (buludların içində) **mələklər bir-bir enər.**

**26)** (اَلْمُلْكُ يَوْمَئِذٍ الْحَقُّ لِلرَّحْمٰنِ) – (qiyamət) **günü həqiqi padşahlıq Allah-Təalaya məxsusdur.** (Allah-Təalanın hakimiyyətindən başqa bütün hakimiyyətlər məhv olar). (وَكَانَ يَوْمًا عَلَى الْكَافِرِينَ عَسِيرًا) – (qiyamət) **günü kafirlərə çətin olar.**

**27)** (وَيَوْمَ يَعَضُّ الظَّالِمُ عَلٰى يَدَيْهِ) – (qiyamət) **günü zalım şəxs** (peşmanlıqdan) **əllərini dişləyər.** (يَقُولُ يَا لَيْتَنِي اتَّخَذْتُ مَعَ الرَّسُولِ سَبِيلًا) – (və belə) **deyər: kaş peyğəmbərlə birlikdə** (haqq) **yolda olub** (ona tabe olub zəlalətdən uzaq olaydım)**.**

**28)** (يَا وَيْلَتٰى لَيْتَنِي لَمْ اَتَّخِذْ فُلَانًا خَلِيلًا) **- vay halıma, kaş filankəsi** (məni zəlalətə salanı) **özümə dost tutmayaydım** (kinayə ilə filankəs deyər)**.**

**29)** (لَقَدْ اَضَلَّنِي عَنِ الذِّكْرِ بَعْدَ اِذْ جَٓاءَنِي) – (Qurani-Şərif) **mənə gələndən sonra o, məni Qurandan kənara, zəlalətə saldı.** (وَكَانَ الشَّيْطَانُ لِلْاِنْسَانِ خَذُولًا) **- şeytan** (pis dost bəla və müsibət vaxtında insanı tərk edib) **tək qoyar.**

**30)** (وَقَالَ الرَّسُولُ يَا رَبِّ اِنَّ قَوْمِي اتَّخَذُوا هٰذَا الْقُرْاٰنَ مَهْجُورًا) **- peyğəmbər** (Hz. Məhəmməd şikayət edib) **dedi: "Rəbbim, həqiqətən, qövmüm** (Qüreyş camaatı sənin) **bu Quranını tərk edib** (ondan üz döndərdilər)**."**

**31)** (وَكَذٰلِكَ جَعَلْنَا لِكُلِّ نَبِيٍّ عَدُوًّا مِنَ الْمُجْرِمِينَ) **-** (ey Məhəmməd, bu Qüreyş tayfası sənə düşmən olub Quranı inkar etdiyi kimi) **habelə hər peyğəmbərdən ötrü**

وَكَفٰى بِرَبِّكَ هَادِيًا وَنَصٖيرًا ﴿٣١﴾ وَقَالَ الَّذٖينَ كَفَرُوا لَوْلَا نُزِّلَ عَلَيْهِ الْقُرْاٰنُ جُمْلَةً وَاحِدَةً ۚ كَذٰلِكَ
لِنُثَبِّتَ بِهٖ فُؤَادَكَ وَرَتَّلْنَاهُ تَرْتٖيلًا ﴿٣٢﴾ وَلَا يَأْتُونَكَ بِمَثَلٍ اِلَّا جِئْنَاكَ بِالْحَقِّ وَاَحْسَنَ تَفْسٖيرًاۜ ﴿٣٣﴾
اَلَّذٖينَ يُحْشَرُونَ عَلٰى وُجُوهِهِمْ اِلٰى جَهَنَّمَۙ اُو۬لٰٓئِكَ شَرٌّ مَكَانًا وَاَضَلُّ سَبٖيلًا ۟ ﴿٣٤﴾ وَلَقَدْ اٰتَيْنَا مُوسَى
الْكِتَابَ وَجَعَلْنَا مَعَهُٓ اَخَاهُ هٰرُونَ وَزٖيرًاۚ ﴿٣٥﴾

---

**günahkar asilərdən bir düşmən etmişdik.** (Onları da sənin kimi inkar edib itaət etmədilər. Təkcə sənin düşmənin yoxdur, bütün peyğəmbərlərin düşməni olub. Səbir et. Necə ki səndən əvvəlki peyğəmbərlər səbir etdilər). (وَكَفٰى بِرَبِّكَ هَادِيًا وَنَصٖيرًا) – (müşrikləri zəlil etmən üçün) **sənə hidayət və kömək etməkdə rəbbin Allah-Təala kifayət edər.** (Bu söz Allah-Təalanın peyğəmbərə vədidir ki, müşriklər sənin əlində zəlil olacaqlar).

**32)** (وَقَالَ الَّذٖينَ كَفَرُوا لَوْلَا نُزِّلَ عَلَيْهِ الْقُرْاٰنُ جُمْلَةً وَاحِدَةً) – (Qüreyşdən) **kafir olanlar dedilər:** (əgər bu Məhəmməd haqq peyğəmbərdirsə,) **niyə Quran ona birdəfəlik nazil olmur** (hissə-hissə nazil olur? Dənizdə qərq olan şəxs, bəlkə, əlinə bir şey keçər deyə hər tərəfə əl atdığı kimi müşriklər də Qurani-Şərifin müqabilində aciz qalandan sonra boş-boş sözlər danışmağa başladılar. Quran birdəfəlik nazil oldu, ya hissə-hissə, onun möcüzə olmasına mane deyil, Quranın müqabilində məəttəl qalıb bir söz deyə bilmədiklərindən belə mənasız sözlərə yapışdılar). (كَذٰلِكَ لِنُثَبِّتَ بِهٖ فُؤَادَكَ) - (Allah-Təala onların cavabında buyurur: "ey Məhəmməd, belədir, biz Quranı hikmət üzrə (23 ilin içində) nazil etdik ki, onun hissə-hissə olması səbəbinə) **sənin qəlbini möhkəmlədib** (ayələri asanlıqla yadda saxlayasan." Musa və İsaya nazil olan kitablar onlar oxuya bildiklərindən birdəfəlik nazil olubdur. Amma bizim peyğəmbərimiz oxuma-yazma bilmədiklərindən Allah-Təala Qurani-Şərifi ona hissə-hissə nazil etdi. Belə ki, ayələri əzbərləyib xalqa çatdırmaqda çətinlik çəkməsin). (وَرَتَّلْنَاهُ تَرْتٖيلًا) – (ey Məhəmməd, Quranı) **dənə-dənə etdik** (ki, oxuyub əzbərləmədə çətinlik çəkməyəsən).

**33)** (وَلَا يَأْتُونَكَ بِمَثَلٍ اِلَّا جِئْنَاكَ بِالْحَقِّ وَاَحْسَنَ تَفْسٖيرًا) - (ey Məhəmməd, müşriklər) **sənə gəlib** (batil) **məsəllər çəkdiklərində, biz** (onların cavabında) **haqq olan və izahı daha gözəl olanı gətirib** (onları rədd edərik. O müşriklər bizim qabağımızda dayana bilməzlər).

**34)** (اَلَّذٖينَ يُحْشَرُونَ عَلٰى وُجُوهِهِمْ اِلٰى جَهَنَّمَ) – (müşriklər) **o şəxslərdir ki,** (qiyamət günündə) **üzləri üstündə cəhənnəmə tərəf** (gətirilib) **toplanarlar.** (اُو۬لٰٓئِكَ شَرٌّ مَكَانًا وَاَضَلُّ سَبٖيلًا) – (qiyamət günündə) **ən pis məkanda olan və** (haqq) **yolundan ən çox zəlalətə düşənlər müşriklərdir.**

**35)** (وَلَقَدْ اٰتَيْنَا مُوسَى الْكِتَابَ وَجَعَلْنَا مَعَهُٓ اَخَاهُ هٰرُونَ وَزٖيرًا) - (ey Məhəmməd, səndən əvvəlki peyğəmbərlərin və ümmətlərin əhvalına bax, peyğəmbərlərə itaət et-

فَقُلْنَا اذْهَبَآ اِلَى الْقَوْمِ الَّذٖينَ كَذَّبُوا بِاٰيَاتِنَاۜ فَدَمَّرْنَاهُمْ تَدْمٖيرًاۜ ﴿٣٦﴾ وَقَوْمَ نُوحٍ لَمَّا كَذَّبُوا الرُّسُلَ
اَغْرَقْنَاهُمْ وَجَعَلْنَاهُمْ لِلنَّاسِ اٰيَةًۜ وَاَعْتَدْنَا لِلظَّالِمٖينَ عَذَابًا اَلٖيمًاۚ ﴿٣٧﴾ وَعَادًا وَثَمُودَا۬ وَاَصْحَابَ
الرَّسِّ وَقُرُونًا بَيْنَ ذٰلِكَ كَثٖيرًا ﴿٣٨﴾ وَكُلًّا ضَرَبْنَا لَهُ الْاَمْثَالَۘ وَكُلًّا تَبَّرْنَا تَتْبٖيرًا ﴿٣٩﴾ وَلَقَدْ اَتَوْا
عَلَى الْقَرْيَةِ الَّتٖٓي اُمْطِرَتْ مَطَرَ السَّوْءِۜ اَفَلَمْ يَكُونُوا يَرَوْنَهَاۚ بَلْ كَانُوا لَا يَرْجُونَ نُشُورًا ﴿٤٠﴾

---

mədiklərindən onlara əzab göndərdik). **Həqiqətən, Musaya kitab** (Tövrat) **verib qardaşı Harunu da ona vəzir etdik.**

**36)** (فَقُلْنَا اذْهَبَا اِلَى الْقَوْمِ الَّذٖينَ كَذَّبُوا بِاٰيَاتِنَا) - (Musa və Haruna əmr edib) **dedik: "Ayələrimizi təkzib edən bir camaatın yanına gedib,** (o qibtiləri bizim tərəfimizə dəvət edin)**."** (فَدَمَّرْنَاهُمْ تَدْمٖيرًا) – (Misir əhli onları təkzib etdi)**. Biz də onları** (dənizə qərq etməklə) **çox pis həlak etdik.**

**37)** (وَقَوْمَ نُوحٍ لَمَّا كَذَّبُوا الرُّسُلَ اَغْرَقْنَاهُمْ وَجَعَلْنَاهُمْ لِلنَّاسِ اٰيَةً) - **Bir də Nuh** (peyğəmbərin) **qövmünü peyğəmbərləri təkzib etdiklərində,** (onları tufana düçar edib) **suda qərq etdik və onları insanlar üçün** (Allah-Təalanın kamil qüdrətinə işarə edən) **dəlil və sübut etdik.** (وَاَعْتَدْنَا لِلظَّالِمٖينَ عَذَابًا اَلٖيمًا) – (qiyamət günü peyğəmbərləri təkzib edən) **zalımlardan ötrü şiddətli əzab hazır etmişik.**

**38)** (وَعَادًا وَثَمُودَا۬ وَاَصْحَابَ الرَّسِّ وَقُرُونًا بَيْنَ ذٰلِكَ كَثٖيرًا) - **Ad, Səmud, Rəss* camaatı və onların arasında olan bir çox camaatı da** (peyğəmbərləri təkzib etdiklərindən həlak edib axirətdə onlardan ötrü şiddətli əzab hazır etmişik)**.**

*(*__Qeyd:__ Rəss məşhur Araz çayıdır, Qafqazda Kür çayına qarışıb Xəzər dənizinə tökülür. Allah-Təala onlara Hz. İsa ilə Hz. Məhəmməd arasında Hanzala ibn Safvan adlı bir peyğəmbər göndərdi, onlar şam ağacına sitayiş edirdilər, Hanzala onları Allah-Təalaya dəvət etdi. Onu təkzib etdilər, axırda o çayın içində dar və dərin bir quyu qazıb onu tutub oraya salıb, quyunun ağzını möhkəm bağlayıb, suyu üstündən axıtdılar. Allah-Təala onların bu əməlinə görə, səmadan bir ildırım göndərib onları həlak etdi).*

**39)** (وَكُلًّا ضَرَبْنَا لَهُ الْاَمْثَالَ) – (bu həlak olan ümmətlərin) **hamısından ötrü** (onlardan əvvəl həlak olan ümmətlərin qəribə qissələrini) **məsəl çəkib** (bəyan etdik ki, bəlkə, ibrət alıb kafir olmasınlar)**.** (وَكُلًّا تَبَّرْنَا تَتْبٖيرًا) – (onlar o qissələrdən ibrət almayıb peyğəmbərləri təkzib etdiklərindən) **biz də onların hamısını dağıdıb həlak etdik.**

**40)** (وَلَقَدْ اَتَوْا عَلَى الْقَرْيَةِ الَّتٖٓي اُمْطِرَتْ مَطَرَ السَّوْءِ اَفَلَمْ يَكُونُوا يَرَوْنَهَا) – (həqiqətən, bu Qüreyş camaatı Şama ticarətə gedəndə daş) **yağışı ilə** (həlak olan Lutun) **şəhərinə gəlib çatmışdılar, bəs onlara baxıb** (Allah-Təalanın əzabının izlərini) **görmədilər?** (بَلْ كَانُوا لَا يَرْجُونَ نُشُورًا) – **xeyr, görürlər, amma** (qiyamət günündə) **dirilməyə inanmadıqlarından** (gördüklərindən ibrət almırlar)**.**

وَاِذَا رَاَوْكَ اِنْ يَتَّخِذُونَكَ اِلَّا هُزُوًاۜ اَهٰذَا الَّذِي بَعَثَ اللّٰهُ رَسُولًا ﴿٤١﴾ اِنْ كَادَ لَيُضِلُّنَا عَنْ اٰلِهَتِنَا
لَوْلَٓا اَنْ صَبَرْنَا عَلَيْهَاۜ وَسَوْفَ يَعْلَمُونَ حِينَ يَرَوْنَ الْعَذَابَ مَنْ اَضَلُّ سَبِيلًا ﴿٤٢﴾ اَرَاَيْتَ مَنِ اتَّخَذَ
اِلٰهَهُ هَوٰيهُۜ اَفَاَنْتَ تَكُونُ عَلَيْهِ وَكِيلًاۙ ﴿٤٣﴾ اَمْ تَحْسَبُ اَنَّ اَكْثَرَهُمْ يَسْمَعُونَ اَوْ يَعْقِلُونَۜ اِنْ هُمْ اِلَّا
كَالْاَنْعَامِ بَلْ هُمْ اَضَلُّ سَبِيلًا ﴿٤٤﴾ اَلَمْ تَرَ اِلٰى رَبِّكَ كَيْفَ مَدَّ الظِّلَّۚ وَلَوْ شَٓاءَ لَجَعَلَهُ سَاكِنًاۚ ثُمَّ
جَعَلْنَا الشَّمْسَ عَلَيْهِ دَلِيلًاۙ ﴿٤٥﴾

---

**41)** (وَاِذَا رَاَوْكَ اِنْ يَتَّخِذُونَكَ اِلَّا هُزُوًا) - (ey Məhəmməd, bu Qüreyş camaatı səni gördükdə)**, ancaq istehza edirlər.** (اَهٰذَا الَّذِي بَعَثَ اللّٰهُ رَسُولًا) – (istehza ilə belə deyirlər:) **Allah-Təalanın peyğəmbər göndərdiyi budur?** (Əbu Talibin bu yetiminin peyğəmbər olmağa nə ləyaqəti var? Əbu Cəhl peyğəmbəri hər dəfə gördükdə, istehza ilə belə deyərdi)**.**

**42)** (اِنْ كَادَ لَيُضِلُّنَا عَنْ اٰلِهَتِنَا لَوْلَٓا اَنْ صَبَرْنَا عَلَيْهَا) - (Əbu Cəhl deyir:) **əgər biz səbir edib,** (ilahlarımıza ibadətdə) **möhkəm olmasaydıq, həqiqətən, az qalmışdı ki,** (Məhəmməd) **bizi zəlalətə salıb** (ilahlarımıza ibadət və sitayiş etməkdən uzaqlaşdırsın. Müşriklərin bu sözləri Hz. Peyğəmbərin Qüreyş camaatını islama dəvət etmək üçün çox cəhd etdiyini göstərir. Amma müşriklər inadlarından Qurana tabe olmayıb küfr və zəlalət içində qaldılar)**.** (وَسَوْفَ يَعْلَمُونَ حِينَ يَرَوْنَ الْعَذَابَ مَنْ اَضَلُّ سَبِيلًا) - (müşriklər tezliklə qiyamət günündə) **əzabı görəndə kimin** (Hz. Məhəmmədin, yoxsa özlərinin haqq) **yolundan kənar olub zəlalətdə olduğunu biləcəklər,**

**43)** (اَرَاَيْتَ مَنِ اتَّخَذَ اِلٰهَهُ هَوٰيهُ اَفَاَنْتَ تَكُونُ عَلَيْهِ وَكِيلًا) - (ey Məhəmməd)**, nəfsini özünə tanrı edəni görürsən? Sən belə şəxsə zamin olub** (müsəlman olmağa vadar edə bilərsən? (Ərəblərdən bir kişi bir daşa sitayiş edirdi, elə ki ondan yaxşı bir daş gördü, o daşa sitayiş edib, əvvəlki daşı tərk edərdi. Daşa sitayiş edənlərdən biri Haris ibn Qeys Səhmi idi)**.**

**44)** (اَمْ تَحْسَبُ اَنَّ اَكْثَرَهُمْ يَسْمَعُونَ اَوْ يَعْقِلُونَ) - (ey Məhəmməd)**, yoxsa sən belə güman edirsən ki,** (bu müşriklərin) **əksəriyyətinin** (haqq eşidən) **qulaqları və** (haqqı dərk edən) **ağılları var,** (ona görə onların islama daxil olmalarında israr edirsən?) (اِنْ هُمْ اِلَّا كَالْاَنْعَامِ بَلْ هُمْ اَضَلُّ سَبِيلًا) **- onlar** (haqqa qarşı qafil olmaqda) **ancaq heyvan kimidirlər, bəlkə, onlardan da artıq zəlalət** (və qəflət) **yolundadırlar.**

**45)** (اَلَمْ تَرَ اِلٰى رَبِّكَ كَيْفَ مَدَّ الظِّلَّ) - (ey Məhəmməd)**, bəs rəbbin Allah-Təalanın** (kamil qüdrətinə) **baxmırsan ki, necə** (gecə vaxtı yerin*) **kölgəsini çəkib, yayıb,** (günəşin qaib olmasıyla yer üzünü qaranlıq edir?) (وَلَوْ شَٓاءَ لَجَعَلَهُ سَاكِنًا) - **əgər Allah-Təala istəsəydi,** (günəşi yaratmayıb, gecənin kölgəsini həmişəlik) **hərəkətsiz edib** (yer üzündə heç bir məxluq olmazdı)**.** (ثُمَّ جَعَلْنَا الشَّمْسَ عَلَيْهِ دَلِيلًا)

**ثُمَّ قَبَضْنَاهُ اِلَيْنَا قَبْضًا يَسِيرًا ﴿٤٦﴾ وَهُوَ الَّذِي جَعَلَ لَكُمُ الَّيْلَ لِبَاسًا وَالنَّوْمَ سُبَاتًا وَجَعَلَ النَّهَارَ نُشُورًا ﴿٤٧﴾ وَهُوَ الَّذِي اَرْسَلَ الرِّيَاحَ بُشْرًا بَيْنَ يَدَيْ رَحْمَتِهِ وَاَنْزَلْنَا مِنَ السَّمَاءِ مَاءً طَهُورًا ﴿٤٨﴾ لِنُحْيِيَ بِهِ بَلْدَةً مَيْتًا وَنُسْقِيَهُ مِمَّا خَلَقْنَا اَنْعَامًا وَاَنَاسِيَّ كَثِيرًا ﴿٤٩﴾**

---

– (gecənin kölgəsini çəkib yayandan) **sonra günəşi onun** (kölgə olmasına) **dəlil etdik.** (Günəşin çıxıb yer üzünü nurlandırmasının dəlil, odur ki, gecənin qaranlığı yerin kölgəsidir)**.**

*(*Qeyd: Yer kürə şəklində olduğundan həmişə bir tərəfi (günəşə baxan tərəfi) işıqlıq, o biri tərəfi yerin öz kölgəsindən qaranlıqdır, günəşin, ya da yerin hərəkəti ilə getdikcə işıqlıq tərəfi qaranlıq (gecə), qaranlıq tərəfi işıqlıq (gündüz) olur, günəşin işıqlığı və hərarəti bütün varlıqlardan ötrü əsas nemət olduğundan Allah-Təala bu ayədə onun böyük nemət olmasını şükür etməmiz üçün bizə bəyan edir).*

**46)** (ثُمَّ قَبَضْنَاهُ اِلَيْنَا قَبْضًا يَسِيرًا) **- ondan sonra** (günəşin yüksəlməsi səbəbinə kölgəni) **yavaş-yavaş öz tərəfimizə çəkib** (birdəfəlik yox edib, yer üzünü nurani etdik)**.**

**47)** (وَهُوَ الَّذِي جَعَلَ لَكُمُ الَّيْلَ لِبَاسًا) – (Allah-Təala öz kamil qüdrəti ilə) **sizdən ötrü gecəni** (libas kimi) **örtü etdi.** (Belə ki, gecələr rahat olasınız)**.** (وَالنَّوْمَ سُبَاتًا وَجَعَلَ النَّهَارَ نُشُورًا) **- yuxunu sizin üçün** (ölüm kimi) **istirahət və gündüzü** (qiyamətdəki kimi dirilmə) **həyat etdi,** (belə ki, ibrət alıb ölüb-dirilməyə etiqad edəsiniz)**.**

**48)** (وَهُوَ الَّذِيٓ اَرْسَلَ الرِّيَاحَ بُشْرًا بَيْنَ يَدَيْ رَحْمَتِهِ) – (Allah-Təala kamil qüdrəti ilə) **küləkləri öz rəhməti** (olan yağışın) **qabağınca müjdə verən göndərdi,** (çox vaxt küləkdən sonra yağış yağar, xüsusilə, şimal küləyindən sonra)**,** (وَاَنْزَلْنَا مِنَ السَّمَاءِ مَاءً طَهُورًا) – (küləyi göndərəndən sonra) **səmadan tərtəmiz* su göndərib** (yer üzünə nazil etdik)**.**

*(***Qeyd:** Suyun təmizliyinə bu kifayət edər ki, özü pak olub, nəcisi pak edəndir. Nəcis suya qarışıb suyun bu 3 xüsusiyyətindən biri - rəngi, dadı, ya da qoxusu dəyişsə, o su nəcis sayılar, amma bu 3 xüsusiyyət dəyişməsə, su əvvəlki kimi təmiz sayılar).*

**49)** (لِنُحْيِيَ بِهِ بَلْدَةً مَيْتًا) – (səmadan yağış göndərdik ki, o yağışın səbəbinə) **ölü məmləkəti dirildib,** (onda təzə, yaşıl ot-ələf göyərdək)**,** (وَنُسْقِيَهُ مِمَّا خَلَقْنَا اَنْعَامًا وَاَنَاسِيَّ كَثِيرًا) – (yenə o yağış səbəbinə) **yaratdığımız heyvanları** (dəvə, öküz, qoyun, keçini) **və insanların əksəriyyətini suvaraq.** (Hərçənd insan və heyvanların hamısının yağışa ehtiyacı olub bütün suların əsli yağışdandır, amma ayədə bu heyvanları, bir də insanların əksəriyyətini yağış suyu ilə suvardığını ona görə bəyan edir ki, əksər insanlar heyvandar olduğundan özlərinin və heyvanlarının yağışa ehtiyacı çoxdur)**.**

وَلَقَدْ صَرَّفْنَاهُ بَيْنَهُمْ لِيَذَّكَّرُواۘ فَاَبٰٓى اَكْثَرُ النَّاسِ اِلَّا كُفُورًا ﴿٥٠﴾ وَلَوْ شِئْنَا لَبَعَثْنَا فٖي كُلِّ قَرْيَةٍ نَذٖيرًاۘ
﴿٥١﴾ فَلَا تُطِعِ الْكَافِرٖينَ وَجَاهِدْهُمْ بِهٖ جِهَادًا كَبٖيرًا ﴿٥٢﴾ وَهُوَ الَّذٖي مَرَجَ الْبَحْرَيْنِ هٰذَا عَذْبٌ
فُرَاتٌ وَهٰذَا مِلْحٌ اُجَاجٌۚ وَجَعَلَ بَيْنَهُمَا بَرْزَخًا وَحِجْرًا مَحْجُورًا ﴿٥٣﴾ وَهُوَ الَّذٖي خَلَقَ مِنَ الْمَٓاءِ بَشَرًا
فَجَعَلَهُ نَسَبًا وَصِهْرًاۜ وَكَانَ رَبُّكَ قَدٖيرًا ﴿٥٤﴾

---

**50)** (وَلَقَدْ صَرَّفْنَاهُ بَيْنَهُمْ لِيَذَّكَّرُوا) **- həqiqətən, biz** (bu yağışı camaatın) **arasında bölüb paylaşdırdıq.** (Bir il bu vilayətə çox, o biri il o birisi vilayətə çox verdik ki, ibrət alıb, düşünüb Allah-Təalanın qüdrətinə agah olsunlar. Yağış və qar Allah-Təalanın qüdrətiylə hər il müəyyən qədər, bu il bura, başqa il o biri yerə daha çox yağar, necə ki həmişə müşahidə olunur. İbn Abbas deyir: "Heç bir ilin yağışı o biri ildən artıq olmaz. Lakin Allah-Təala öz açıq-aşkar qüdrəti ilə bir il bir yerə çox, o biri yerə az yağış göndərir ki, camaat ibrət alıb Allah-Təalaya şükür etsinlər.") (فَاَبٰى اَكْثَرُ النَّاسِ اِلَّا كُفُورًا) **- amma insanların əksəriyyəti** (şükür etməyib) **kafir oldular.**

**51)** (وَلَوْ شِئْنَا لَبَعَثْنَا فٖي كُلِّ قَرْيَةٍ نَذٖيرًا) **-** (ey Məhəmməd)**, əgər biz istəsək, hər bir məmləkətin** (əhlinə onları) **qorxudan bir peyğəmbər göndərərdik** (ki, onları bizim tərəfimizə dəvət etsinlər, lakin ey Məhəmməd, sənin əzəmət və şövkətinə görə peyğəmbərliyi sənə məxsus edib sənin zamanında səndən başqa bir peyğəmbər göndərmədik. Sən də səbir edib möhkəm ol, sənə vəhy olunanı camaata təbliğ et)**.**

**52)** (فَلَا تُطِعِ الْكَافِرٖينَ وَجَاهِدْهُمْ بِهٖ جِهَادًا كَبٖيرًا) **-** (ey Məhəmməd)**, kafirlərə tabe olma və** (peyğəmbər olduğun üçün) **onlarla böyük** (hər cür) **cihad edib** (onları islama dəvət et)**.**

**53)** (وَهُوَ الَّذٖي مَرَجَ الْبَحْرَيْنِ) **–** (Allah-Təala öz kamil qüdrəti ilə) **iki dənizi bir-birinə** (qonşu edib) **qovuşdurdu.** (هٰذَا عَذْبٌ فُرَاتٌ) **- biri şirin və dadlıdır,** (dənizlərə axan çayların suyu), (وَهٰذَا مِلْحٌ اُجَاجٌ) **– biri də şor və acıdır** (dəniz suyudur. Şirin sular dənizlərə axar. Bir-birilərinə qovuşduqları yerdə bir tərəfi şirin, o biri tərəfi şor olar)**.** (وَجَعَلَ بَيْنَهُمَا بَرْزَخًا وَحِجْرًا مَحْجُورًا) **–** (qarışmamaları üçün Allah-Təala o iki suyun) **arasına əngəl və sədd qoyub,** (qarışmalarına mane olar)**.**

**54)** (وَهُوَ الَّذٖي خَلَقَ مِنَ الْمَٓاءِ بَشَرًا فَجَعَلَهُ نَسَبًا وَصِهْرًا) **– (Allah-Təala öz kamil qüdrəti ilə sudan** (spermadan iki cins - kişi və qadın) **insan yaratdı,** (kişini) **soydan ötrü** (nəsli bir soya isnad etmək üçün, qadını nəsil artırmaqdan ötrü) **evlilik yoluyla qohum olmaq üçün təyin etdi.** (وَكَانَ رَبُّكَ قَدٖيرًا) **-** (ey Məhəmməd)**, sənin rəbbin Allah-Təala bir şeyə qadirdir,** (bir spermadan iki cins insan – kişi və qadın yaratdı)**.**

**وَيَعْبُدُونَ مِنْ دُونِ اللّٰهِ مَا لَا يَنْفَعُهُمْ وَلَا يَضُرُّهُمْ وَكَانَ الْكَافِرُ عَلٰى رَبِّه۪ ظَه۪يرًا ﴿٥٥﴾ وَمَٓا اَرْسَلْنَاكَ**
**اِلَّا مُبَشِّرًا وَنَذ۪يرًا ﴿٥٦﴾ قُلْ مَٓا اَسْـَٔلُكُمْ عَلَيْهِ مِنْ اَجْرٍ اِلَّا مَنْ شَٓاءَ اَنْ يَتَّخِذَ اِلٰى رَبِّه۪ سَب۪يلًا ﴿٥٧﴾**
**وَتَوَكَّلْ عَلَى الْحَيِّ الَّذ۪ي لَا يَمُوتُ وَسَبِّحْ بِحَمْدِه۪ وَكَفٰى بِه۪ بِذُنُوبِ عِبَادِه۪ خَب۪يرًاۚ ﴿٥٨﴾ اَلَّذ۪ي**
**خَلَقَ السَّمٰوَاتِ وَالْاَرْضَ وَمَا بَيْنَهُمَا ف۪ي سِتَّةِ اَيَّامٍ ثُمَّ اسْتَوٰى عَلَى الْعَرْشِۚ اَلرَّحْمٰنُ فَسْـَٔلْ بِه۪ خَب۪يرًا**
**﴿٥٩﴾ وَاِذَا ق۪يلَ لَهُمُ اسْجُدُوا لِلرَّحْمٰنِ قَالُوا وَمَا الرَّحْمٰنُ اَنَسْجُدُ لِمَا تَأْمُرُنَا وَزَادَهُمْ نُفُورًا۟ ﴿٦٠﴾**

---

**55)** (وَيَعْبُدُونَ مِنْ دُونِ اللّٰهِ مَا لَا يَنْفَعُهُمْ وَلَا يَضُرُّهُمْ) - (ey Məhəmməd, müşriklər Allah-Təaladan başqa elə şeylərə ibadət edirlər ki, onlara nə mənfəət, nə də zərər verməzlər)**.** (وَكَانَ الْكَافِرُ عَلٰى رَبِّه۪ ظَه۪يرًا) - **kafirlər** (bütlərə sitayiş etməkdə şeytana tabe olub)**, Allah-Təalaya arxa çevirib** (asi olmaqda bir-birilərinə kömək edirlər)**.**

**56)** (وَمَٓا اَرْسَلْنَاكَ اِلَّا مُبَشِّرًا وَنَذ۪يرًا) - (ey Məhəmməd)**, səni ancaq** (rəhmətimizlə) **müjdələyən,** (əzabımızla) **qorxudan olaraq göndərdik.**

**57)** (قُلْ مَٓا اَسْـَٔلُكُمْ عَلَيْهِ مِنْ اَجْرٍ اِلَّا مَنْ شَٓاءَ اَنْ يَتَّخِذَ اِلٰى رَبِّه۪ سَب۪يلًا) - (ey Məhəmməd, xalqa) **de ki, mən** (vəhyi təbliğ edib, Allah-Təalanın ehkamını sizə çatdırmaqdan ötrü) **sizdən heç bir mükafat istəmirəm,** (və sizə demirəm ki, malınızdan mənə də verin. Sizin malınız mənə lazım deyil. Malını Allah-Təala yolunda xərcləyib islamı yaymaqla) **öz rəbbi Allah-Təalaya tərəf** (haqq) **yolu tapan şəxs** (olun. Belə şəxsə mən demirəm ki, haqq yolunda xərcləmə, əksinə islamı yaymaq üçün mal-dövlətdən keçmək Allah-Təalanın dininə yardımdır)**.**

**58)** (وَتَوَكَّلْ عَلَى الْحَيِّ الَّذ۪ي لَا يَمُوتُ وَسَبِّحْ بِحَمْدِه۪) – (ey Məhəmməd)**, ölməyən, həmişə diri olan Allah-Təalaya təvəkkül edib, onu həmd-səna ilə zikr edib təqdis et.** (وَكَفٰى بِه۪ بِذُنُوبِ عِبَادِه۪ خَب۪يرًا) - **Allah-Təala bəndələrinin günahlarından xəbərdar olduğu halda, özü kifayət edər,** (və o günahların cəzasını onlara verəcəkdir)**.**

**59)** (اَلَّذ۪ي خَلَقَ السَّمٰوَاتِ وَالْاَرْضَ وَمَا بَيْنَهُمَا ف۪ي سِتَّةِ اَيَّامٍ) – (Allah-Təalanın sifətlərindən biri) **odur ki, öz kamil qüdrəti ilə səmaları, yeri və onların arasında olan** (məxluqatı) **6 gündə yaratdı.** (ثُمَّ اسْتَوٰى عَلَى الْعَرْشِ اَلرَّحْمٰنُ) – (səmaları və yeri yaradandan) **sonra Rəhman olan olan Allah-Təala ərşə** (aləmə) **hakim oldu.** (فَسْـَٔلْ بِه۪ خَب۪يرًا) – (ey Məhəmməd, səmaların, yerin və bütün varlıqların necə yaradıldığını) **xəbərdar və alim olan Allah-Təaladan soruş** (ki, sənə bəyan etsin)**.**

**60)** (وَاِذَا ق۪يلَ لَهُمُ اسْجُدُوا لِلرَّحْمٰنِ) - **müşriklərə deyildiyi zaman,** (yəni ey Məhəmməd, sən onlara dedikdə)**, Rəhman olan Allah-Təalaya səcdə edin.** (قَالُوا وَمَا الرَّحْمٰنُ اَنَسْجُدُ لِمَا تَأْمُرُنَا) - (cavabında) **dedilər: "Rəhman nədir? Bizə əmr etdiyin şeyə səcdə edəcəyik?"** (وَزَادَهُمْ نُفُورًا) - (ey Məhəmməd, Allah-

تَبَارَكَ الَّذِي جَعَلَ فِي السَّمَآءِ بُرُوجًا وَجَعَلَ فِيهَا سِرَاجًا وَقَمَرًا مُنِيرًا ﴿٦١﴾ وَهُوَ الَّذِي جَعَلَ الَّيْلَ
وَالنَّهَارَ خِلْفَةً لِمَنْ اَرَادَ اَنْ يَذَّكَّرَ اَوْ اَرَادَ شُكُورًا ﴿٦٢﴾ وَعِبَادُ الرَّحْمٰنِ الَّذِينَ يَمْشُونَ عَلَى الْاَرْضِ
هَوْنًا وَاِذَا خَاطَبَهُمُ الْجَاهِلُونَ قَالُوا سَلَامًا ﴿٦٣﴾ وَالَّذِينَ يَبِيتُونَ لِرَبِّهِمْ سُجَّدًا وَقِيَامًا ﴿٦٤﴾
وَالَّذِينَ يَقُولُونَ رَبَّنَا اصْرِفْ عَنَّا عَذَابَ جَهَنَّمَ اِنَّ عَذَابَهَا كَانَ غَرَامًا ﴿٦٥﴾ اِنَّهَا سَاءَتْ مُسْتَقَرًّا
وَمُقَامًا ﴿٦٦﴾ وَالَّذِينَ اِذَآ اَنْفَقُوا لَمْ يُسْرِفُوا وَلَمْ يَقْتُرُوا وَكَانَ بَيْنَ ذٰلِكَ قَوَامًا ﴿٦٧﴾

---

Təalaya səcdə etmə əmri) **onların nifrətini daha da artırıb** (Qurana iman gətirməkdən üz döndərdilər**).**

**61)** (تَبَارَكَ الَّذِي جَعَلَ فِي السَّمَآءِ بُرُوجًا) **- ucadır o Allah-Təala ki, səmada** (12) **bürcü yaratdı.** (12 bürcün təfsilatı Hicr surəsinin 18-ci ayəsinin təfsirində keçdi)**.** (وَجَعَلَ فِيهَا سِرَاجًا وَقَمَرًا مُنِيرًا) – (yenə səmada aləmi nurlandıran) **bir çıraq** (günəş)**, bir də** (gecəni) **aydınladan ay yaratdı.**

**62)** (وَهُوَ الَّذِي جَعَلَ الَّيْلَ وَالنَّهَارَ خِلْفَةً لِمَنْ اَرَادَ اَنْ يَذَّكَّرَ اَوْ اَرَادَ شُكُورًا) – **düşünüb** (tövhidə gəlmək)**, ya da** (Allaha) **şükür etmək istəyən şəxsdən ötrü** (Allah-Təala öz kamil qüdrəti ilə) **gecə-gündüzü biri-birinin dalınca aparıb gətirir,** (belə şəxslər gecə-gündüzdən ya ibrət alıb kamilləşərək tövhidi dərk edərlər, ya da mömindirlərsə, Allah-Təalaya şükür edərlər)**.**

**63)** (وَعِبَادُ الرَّحْمٰنِ الَّذِينَ يَمْشُونَ عَلَى الْاَرْضِ هَوْنًا) **-** (bundan sonra gələn ayələrdə möminlərin xüsusiyyəti bəyan edilir:) **Rəhman olan Allah-Təalanın** (mömin) **bəndələri o şəxslərdir ki,** (təkəbbürü tərk edib)**, yer üzündə təmkinlə** (təvazö ilə) **yol gedirlər.** (وَاِذَا خَاطَبَهُمُ الْجَاهِلُونَ قَالُوا سَلَامًا) **- cahil şəxslər onlara** (qəbih) **söz dedikdə,** (möminlər onlara) **– salam,** (biz sizin kimi cahilləşib söz atmarıq, sizi tərk edirik)**, deyərlər.**

**64)** (وَالَّذِينَ يَبِيتُونَ لِرَبِّهِمْ سُجَّدًا وَقِيَامًا) – (möminlərin xüsusiyyətlərindən biri də odur ki, gecənin (hamısını, ya da bir qismini) **öz rəbləri Allah-Təaladan ötrü səcdədə və qiyamda keçirərlər.**

**65)** (وَالَّذِينَ يَقُولُونَ رَبَّنَا اصْرِفْ عَنَّا عَذَابَ جَهَنَّمَ) – (möminlərin xüsusiyyətlərindən biri də odur ki, dua edib belə) **deyərlər: "Ey bizim rəbbimiz, cəhənnəmin əzabını bizdən sovuşdur,** (اِنَّ عَذَابَهَا كَانَ غَرَامًا) **- həqiqətən,** (cəhənnəm) **əzabı həmişəlikdir",** (asilərə daim əzab verəndir)**.**

**66)** (اِنَّهَا سَاءَتْ مُسْتَقَرًّا وَمُقَامًا) **- həqiqətən, cəhənnəm nə pis məskən, nə pis yerdir.**

**67)** (وَالَّذِينَ اِذَآ اَنْفَقُوا لَمْ يُسْرِفُوا وَلَمْ يَقْتُرُوا وَكَانَ بَيْنَ ذٰلِكَ قَوَامًا) – (möminlərin xüsusiyyətlərindən biri də odur ki, Allah-Təala yolunda) **sədəqə verdikdə, nə** (başqa-

وَالَّذِينَ لَا يَدْعُونَ مَعَ اللّٰهِ اِلٰهًا اٰخَرَ وَلَا يَقْتُلُونَ النَّفْسَ الَّتِي حَرَّمَ اللّٰهُ اِلَّا بِالْحَقِّ وَلَا يَزْنُونَۚ وَمَنْ يَفْعَلْ ذٰلِكَ يَلْقَ اَثَامًاۙ ﴿٦٨﴾ يُضَاعَفْ لَهُ الْعَذَابُ يَوْمَ الْقِيٰمَةِ وَيَخْلُدْ فِيهِ مُهَانًاۗ ﴿٦٩﴾ اِلَّا مَنْ تَابَ وَاٰمَنَ وَعَمِلَ عَمَلًا صَالِحًا فَاُو۬لٰٓئِكَ يُبَدِّلُ اللّٰهُ سَيِّاٰتِهِمْ حَسَنَاتٍۜ وَكَانَ اللّٰهُ غَفُورًا رَحِيمًا ﴿٧٠﴾ وَمَنْ تَابَ وَعَمِلَ صَالِحًا فَاِنَّهُ يَتُوبُ اِلَى اللّٰهِ مَتَابًا ﴿٧١﴾ وَالَّذِينَ لَا يَشْهَدُونَ الزُّورَۙ وَاِذَا مَرُّوا بِاللَّغْوِ مَرُّوا كِرَامًا ﴿٧٢﴾

---

larına möhtac olacaq qədər verib) **israf etməzlər, nə də** (Allah-Təala yolunda heç bir şey verməyib) **xəsislik etməzlər, bu ikisinin arasında olarlar.**

**68)** (وَالَّذِينَ لَا يَدْعُونَ مَعَ اللّٰهِ اِلٰهًا اٰخَرَ) – (möminlərin xüsusiyyətlərindən biri də odur ki,) **Allah-Təala ilə yanaşı başqa məbuda ibadət edib** (ona şərik qoşmazlar). (وَلَا يَقْتُلُونَ النَّفْسَ الَّتِي حَرَّمَ اللّٰهُ اِلَّا بِالْحَقِّ) **- Allah-Təalanın haram etdiyi canı haqq** (və ədalət) **istisna olmaqla öldürməzlər** (ancaq qisas, ya da cəza tətbiqi istisnadır), (وَلَا يَزْنُونَ) **- və zina da etməzlər.** (وَمَنْ يَفْعَلْ ذٰلِكَ يَلْقَ اَثَامًا) **- kim ki, bu** (zikr olunan qəbih əməllərdən birini) **etsə,** (qiyamət günündə o əməlin) **cəzasını çəkib** (əzaba düçar olacaq).

**69)** (يُضَاعَفْ لَهُ الْعَذَابُ يَوْمَ الْقِيٰمَةِ وَيَخْلُدْ فِيهِ مُهَانًا)**- qiyamət günü** (əməlinin cəzası ilə) **qarşılaşanda əzabı qat-qat** (əbədi) **olub, zəlil olduğu halda orda əbədi qalar.**

**70)** (اِلَّا مَنْ تَابَ وَاٰمَنَ وَعَمِلَ عَمَلًا صَالِحًا) – (dünyada bu qəbih əməlləri edənlər axirətdə əbədi əzaba düçar olacaq)**, ancaq tövbə edib,** (Allah-Təalaya) **iman gətirib, saleh əməl edənlər istisnadır.** (فَاُو۬لٰٓئِكَ يُبَدِّلُ اللّٰهُ سَيِّاٰتِهِمْ حَسَنَاتٍ) **- Allah-Təala belə şəxslərin günahlarını döndərib savab edər.** (وَكَانَ اللّٰهُ غَفُورًا رَحِيمًا) **- Allah-Təala** (tövbəkarları) **bağışlayıb rəhm edəndir.**

**71)** (وَمَنْ تَابَ وَعَمِلَ صَالِحًا فَاِنَّهُ يَتُوبُ اِلَى اللّٰهِ مَتَابًا) **- kim** (qəbih əməlindən) **tövbə edib saleh əməl etsə, həqiqətən, o, tövbəsi qəbul olduğu halda, Allah-Təalaya dönər,** (Allah-Təala da ondan razı olar).

**72)** (وَالَّذِينَ لَا يَشْهَدُونَ الزُّورَ) – (bir də möminlərin xüsusiyyətlərindən biri də odur ki, nəinki özləri) **yalandan şəhadət etməz,** (hətta yalan danışılan məclislərdə də dayanmazlar ki, qulaqları yalan sözlər eşitməsin). (وَاِذَا مَرُّوا بِاللَّغْوِ مَرُّوا كِرَامًا) **– boş şey** (danışılan bir məclisə*) **gəldiklərində, üz döndərib gedərlər.**

*(*Qeyd: Niyə islam ümməti bu ayəyə baxıb ibrət alıb, mənasız əməlləri tərk etmirlər? Müsəlmanların yalançı şahidliklərini islama isnad edib tənə edənlər bu ayəyə baxsınlar ki, Allah-Təala necə yalan və boş sözlər danışılan bir məclisdə olan şəxsləri möminlərin sırasından xaric edir. Necə demək olar ki, islamda yalandan şəhadət etmək caizdir. Bəlkə, islam ümmətinin zahirdə müsəlman olub, batində islamdan xəbərdar olmayan nümayəndələri az bir məbləğə dinlərini satıb, nəfsani arzulara tabe olurlar.*

وَالَّذِينَ اِذَا ذُكِّرُوا بِاٰيَاتِ رَبِّهِمْ لَمْ يَخِرُّوا عَلَيْهَا صُمًّا وَعُمْيَانًا ﴿٧٣﴾ وَالَّذِينَ يَقُولُونَ رَبَّنَا هَبْ لَنَا
مِنْ اَزْوَاجِنَا وَذُرِّيَّاتِنَا قُرَّةَ اَعْيُنٍ وَاجْعَلْنَا لِلْمُتَّقِينَ اِمَامًا ﴿٧٤﴾ اُولٰٓئِكَ يُجْزَوْنَ الْغُرْفَةَ بِمَا صَبَرُوا
وَيُلَقَّوْنَ فِيهَا تَحِيَّةً وَسَلَامًا ﴿٧٥﴾ خَالِدِينَ فِيهَا حَسُنَتْ مُسْتَقَرًّا وَمُقَامًا ﴿٧٦﴾ قُلْ مَا يَعْبَؤُا بِكُمْ
رَبِّي لَوْلَا دُعَآؤُكُمْ فَقَدْ كَذَّبْتُمْ فَسَوْفَ يَكُونُ لِزَامًا ﴿٧٧﴾

---

*Ya da özləri kimi xəbis şəxslərin arzusu ilə yalandan şəhadət edib haqqı tapdalayırlar. İslamın adını özgə dinlərin arasında bədnam edib yalandan şəhadət etməklə bunu islama isnad edib, guya caiz olduğuna səbəb olurlar. Belə şəxslər hərçənd özlərini müsəlman saysalar da, amma əslindən müşrik olub, islamdan çıxmış olurlar. Heyf ki, Qurani-Şərifin belə gözəl ehkamları camaatın arasında hökmsüz qalıb, rəy sahiblərinin nəfsani hökmlərinə tabe olunmaqla, islamda bidətlər peyda olubdur).*

**73)** (وَالَّذِينَ اِذَا ذُكِّرُوا بِاٰيَاتِ رَبِّهِمْ لَمْ يَخِرُّوا عَلَيْهَا صُمًّا وَعُمْيَانًا) – (möminlərin xüsusiyyətlərindən biri də budur ki,) **onlara öz rəbləri Allah-Təalanın ayələri** (Quran) **oxunduqda, ona qarşı kor və kar olmazlar,** (əksinə, canla-başla Qurani-Şərifin ayələrinə baxıb, qulaq asıb, ehkamını dərk edib özlərinə rəhbər edərlər)**.**

**74)** (وَالَّذِينَ يَقُولُونَ رَبَّنَا هَبْ لَنَا مِنْ اَزْوَاجِنَا وَذُرِّيَّاتِنَا قُرَّةَ اَعْيُنٍ) – (möminlərin xüsusiyyətlərindən biri də budur ki, dua edib belə) **deyərlər: "Ey bizim rəbbimiz, bizə elə arvadlar və övlad bağışlayıb qismət et ki,** (sənin əmrinə itaət edib sənə ibadət etmələri səbəbinə) **gözümüz işıqlansın.** (وَاجْعَلْنَا لِلْمُتَّقِينَ اِمَامًا) **- bizi müttəqilərə rəhbər et** (ki, bizim əməllərimizə baxıb, onlar da bizə tabe olub xeyir əməl etsinlər. Müttəqilərə rəhbər olmaqda məqsəd təqvanın ən yüksək dərəcəsinə sahib olmaqdır)**.**

**75)** (اُولٰٓئِكَ يُجْزَوْنَ الْغُرْفَةَ بِمَا صَبَرُوا) – (ey Məhəmməd, bu zikr olunan möminlər dünyada günahı tərk edib, itaət və ibadətə və kafirlərin əziyyətinə) **səbir etdiklərindən cənnətdəki ən yüksək guşələrlə mükafatlandırılarlar.** (وَيُلَقَّوْنَ فِيهَا تَحِيَّةً وَسَلَامًا) – **orada** (əbədi qalmaları üçün mələklər tərəfindən dua və) **salamla qarşılanarlar.**

**76)** (خَالِدِينَ فِيهَا حَسُنَتْ مُسْتَقَرًّا وَمُقَامًا) – (o guşələrdə) **əbədi qalacaqlar, məskən və mənzilləri necə də gözəldir.** (İlahi, bizə qulluq şüuru və yardım lütf edib itaətkar bəndələrindən et və insanlıq xüsusiyyəti bəxş et, amin!)

**77)** (قُلْ مَا يَعْبَؤُا بِكُمْ رَبِّي لَوْلَا دُعَآؤُكُمْ) – (ey Məhəmməd, bu Məkkə müşriklərinə) **de ki, əgər itaət və ibadət etməsəniz, rəbbim Allah-Təala sizlərə dəyər verməz.** (Təbliğin məqsədi Allah-Təalaya itaət və ibadət etmənizdir)**.** (فَقَدْ كَذَّبْتُمْ فَسَوْفَ يَكُونُ لِزَامًا) **- Allah-Təalanın** (hökmünə müxalif olub) **təkzib etdiniz,** (bu səbəbdən tezliklə qiyamət günündə cəhənnəm) **əzabına düçar olub** (oradan çıxa bilməyəcəksiniz)**.**

Allaha həmd olsun, Furqan surəsinin təfsiri bitdi. İlahi, Qurani-Şərifin təfsirini axıra kimi yazıb qurtarmaq üçün yardımını istəyirəm. Bu mübarək surə möminlərin xüsusiyyətlərini ehtiva edən bir surədir. Xoşbəxt o şəxsdir ki, bu sifətlərə sahib olub insanlığın ən yüksək dərəcəsinə çatsın. Hz. Peyğəmbər buyurubdur: "Kim Furqan surəsini oxusa, qiyamət gününə etiqad etdiyi halda Allah-Təalaya qovuşar." Yəni bu mübarək surəni oxuyan şəxs onun uca məzmununa, eyni zamanda qiyamət gününə etiqad edər).



## əş-ŞUARA SURƏSİ

26-cı surədir. Məkkədə nazil olub, 227 ayə, 1298 kəlmə, 5540 hərfdir.



بِسْمِ اللّٰهِ الرَّحْمٰنِ الرَّحِيمِ. طٰسٓمٓ ﴿١﴾ تِلْكَ اٰيَاتُ الْكِتَابِ الْمُبِينِ ﴿٢﴾ لَعَلَّكَ بَاخِعٌ نَفْسَكَ اَلَّا
يَكُونُوا مُؤْمِنِينَ ﴿٣﴾ اِنْ نَشَأْ نُنَزِّلْ عَلَيْهِمْ مِنَ السَّمَٓاءِ اٰيَةً فَظَلَّتْ اَعْنَاقُهُمْ لَهَا خَاضِعِينَ ﴿٤﴾ وَمَا
يَأْتِيهِمْ مِنْ ذِكْرٍ مِنَ الرَّحْمٰنِ مُحْدَثٍ اِلَّا كَانُوا عَنْهُ مُعْرِضِينَ ﴿٥﴾ فَقَدْ كَذَّبُوا فَسَيَأْتِيهِمْ اَنْبٰٓؤُا مَا
كَانُوا بِهِ يَسْتَهْزِؤُنَ ﴿٦﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1)** (طٰسٓمٓ) **- bu surənin adıdır.**

**2)** (تِلْكَ اٰيَاتُ الْكِتَابِ الْمُبِينِ) **- bu** (surədə zikr olunan ayələr Allah-Təalanın tövhidinə işarə edən ecazkar və) **açıq-aydın Quran ayələridir.**

**3)** (لَعَلَّكَ بَاخِعٌ نَفْسَكَ اَلَّا يَكُونُوا مُؤْمِنِينَ) - (ey Məhəmməd, qövmün sənə itaət edib) **iman etmədi deyə özünü həlak edəcəksən?** (Onlar iman etsinlər deyə həsrət çəkib özünü yorma, onlar iman edən deyil)**.**

**4)** (اِنْ نَشَأْ نُنَزِّلْ عَلَيْهِمْ مِنَ السَّمَٓاءِ اٰيَةً) - (ey Məhəmməd, bu müşriklərin iman etməsini çox istəyirsən)**, amma əgər biz istəsək, səmadan onlara bir əlamət nazil edərik,** (o əlamətin səbəbinə zorla iman edərlər)**.** (فَظَلَّتْ اَعْنَاقُهُمْ لَهَا خَاضِعِينَ) **–** (o əlamətlərdən müşriklər təvazö ilə) **boyun əyib** (Allah-Təalanın itaətindən çıxa bilməzlər. Amma biz insanları azad yaradıb əməllərinin ixtiyarını özlərinə həvalə etdiyimizdən, qiyamət günündə də hər kəsə öz seçdiyi əməlin cəzası veriləcəyindən iman etsinlər deyə onları zorlamayıb iman edib-etməməyi özlərinə həvalə etdik. Ey Məhəmməd, sən də onların imana daxil olmaları üçün həsrət çəkib özünü yorma)**.**

**5)** (وَمَا يَأْتِيهِمْ مِنْ ذِكْرٍ مِنَ الرَّحْمٰنِ مُحْدَثٍ اِلَّا كَانُوا عَنْهُ مُعْرِضِينَ) - (ey Məhəmməd)**, Rəhman olan Allah-Təaladan nə ki hökm və nəsihət gəlir,** (bu müşriklər onu qəbul etməyib) **üz döndərirlər.** (Belə camaatın iman etməsinə ümid etmək lazım deyil)**.**

**6)** (فَقَدْ كَذَّبُوا فَسَيَأْتِيهِمْ اَنْبٰٓؤُا مَا كَانُوا بِهِ يَسْتَهْزِؤُنَ) - (ey Məhəmməd, Quranı) **təkzib etdilər, əlbəttə** (qiyamət günü) **istehza etdikləri** (Quranın) **xəbərləri onlara məlum olar,** (doğru, yoxsa yalan olduğunu bilərlər, amma o vaxt da bunun onlara faydası olmaz)**.**

اَوَلَمْ يَرَوْا اِلَى الْاَرْضِ كَمْ اَنْبَتْنَا فِيهَا مِنْ كُلِّ زَوْجٍ كَرِيمٍ ﴿٧﴾ اِنَّ فِي ذٰلِكَ لَاٰيَةً وَمَا كَانَ اَكْثَرُهُمْ مُؤْمِنِينَ ﴿٨﴾ وَاِنَّ رَبَّكَ لَهُوَ الْعَزِيزُ الرَّحِيمُ ﴿٩﴾ وَاِذْ نَادٰى رَبُّكَ مُوسٰى اَنِ ائْتِ الْقَوْمَ الظَّالِمِينَ ﴿١٠﴾ قَوْمَ فِرْعَوْنَ اَلَا يَتَّقُونَ ﴿١١﴾ قَالَ رَبِّ اِنِّي اَخَافُ اَنْ يُكَذِّبُونِ ﴿١٢﴾ وَيَضِيقُ صَدْرِي وَلَا يَنْطَلِقُ لِسَانِي فَاَرْسِلْ اِلٰى هٰرُونَ ﴿١٣﴾ وَلَهُمْ عَلَيَّ ذَنْبٌ فَاَخَافُ اَنْ يَقْتُلُونِ ﴿١٤﴾

---

**7)** (اَوَلَمْ يَرَوْا اِلَى الْاَرْضِ كَمْ اَنْبَتْنَا فِيهَا مِنْ كُلِّ زَوْجٍ كَرِيمٍ)– **bəs** (müşriklər) **yer üzünə baxmırlar ki, biz** (o yerdə insan və heyvana lazım olan) **hər cür gözəl** (ot-ələflərdən) **nə qədər yetişdirmişik?** (Belə ki, qüdrətimizdən agah olsunlar)**.**

**8)** (اِنَّ فِي ذٰلِكَ لَاٰيَةً وَمَا كَانَ اَكْثَرُهُمْ مُؤْمِنِينَ) **- həqiqətən, bu** (ot-ələflərin yetişməsində onları yetişdirən Xaliqin qüdrətinə) **dəlil və sübutlar var. Amma insanların əksəriyyəti** (dəlil və sübuta baxıb) **iman gətirən deyil.**

**9)** (وَاِنَّ رَبَّكَ لَهُوَ الْعَزِيزُ الرَّحِيمُ) – (ey Məhəmməd)**, həqiqətən sənin rəbbin Allah-Təala** (müşriklərə) **qalib** (olub onlardan intiqam alandır, tövbə edib saleh əməl edənləri də bağışlayıb) **rəhm edəndir.** (Bundan sonra zikr olunan 7 peyğəmbərin hər birinin qissələrinin sonunda bu iki ayənin təkrar-təkrar zikr olunması bu mübarək surəyə başqa bir hüsn və fəsahət, bəlağət bəxş edibdir ki, digər surələrdə o mövcud deyil)**.**

**10)** (وَاِذْ نَادٰى رَبُّكَ مُوسٰى اَنِ ائْتِ الْقَوْمَ الظَّالِمِينَ) **-** (ey Məhəmməd, yadına sal ki,) **rəbbin Allah-Təala Musaya belə əmr etmişdi:** (ey Musa)**, get bu zalım camaatı** (bizim tərəfimizə dəvət et)**.**

**11)** (قَوْمَ فِرْعَوْنَ اَلَا يَتَّقُونَ) – (o zalım camaat) **fironun qövmüdür.** (ey Musa, bu zalım camaat Allah-Təaladan) **qorxub,** (itaət edib, bütpərəstlikdən vaz keçməyəcəklər? Yəni ey Musa, Allah-Təaladan qorxmayan bu zalım camaatı bizim tərəfimizə dəvət et.)**.**

**12)** (قَالَ رَبِّ اِنِّي اَخَافُ اَنْ يُكَذِّبُونِ) **-** (Musa) **dedi: "Ey mənim rəbbim, qorxuram ki,** (sözümü qəbul etməyib)**, məni təkzib etsinlər.**

**13)** (وَيَضِيقُ صَدْرِي وَلَا يَنْطَلِقُ لِسَانِي) – (bir də qorxuram ki,) **qəlbim sıxılıb, dilim pəltəklik edib** (gözəl danışa bilməyim)**,** (فَاَرْسِلْ اِلٰى هٰرُونَ) – (mələk göndərib) **Haruna da** (peyğəmbərlik bəxş et ki, peyğəmbərlikdə mənə köməkçi olsun)**.**

**14)** (وَلَهُمْ عَلَيَّ ذَنْبٌ فَاَخَافُ اَنْ يَقْتُلُونِ) – (fironun qövmü olan qibtilərə) **qarşı üstümdə bir günah var.** (Musa Misirdə olarkən qibtilərdən birini yumruqla vurub öldürmüşdü. Burada ona işarə edir. Bu hadisə bundan sonra gələn Qəsəs surəsində zikr olunacaq)**, qorxuram ki,** (o günahın səbəbinə) **məni qətlə yetirsinlər."**

قَالَ كَلَّاۚ فَاذْهَبَا بِاٰيَاتِنَآ اِنَّا مَعَكُمْ مُسْتَمِعُونَ ﴿١٥﴾ فَأْتِيَا فِرْعَوْنَ فَقُولَآ اِنَّا رَسُولُ رَبِّ الْعَالَمِينَ
﴿١٦﴾ اَنْ اَرْسِلْ مَعَنَا بَنٖي اِسْرَآءِيلَ ﴿١٧﴾ قَالَ اَلَمْ نُرَبِّكَ فٖينَا وَلٖيدًا وَلَبِثْتَ فٖينَا مِنْ عُمُرِكَ سِنٖينَ
﴿١٨﴾ وَفَعَلْتَ فَعْلَتَكَ الَّتٖي فَعَلْتَ وَاَنْتَ مِنَ الْكَافِرٖينَ ﴿١٩﴾ قَالَ فَعَلْتُهَآ اِذًا وَاَنَا مِنَ الضَّآلّٖينَ
﴿٢٠﴾ فَفَرَرْتُ مِنْكُمْ لَمَّا خِفْتُكُمْ فَوَهَبَ لٖي رَبّٖي حُكْمًا وَجَعَلَنٖي مِنَ الْمُرْسَلٖينَ ﴿٢١﴾

---

**15)** (قَالَ كَلَّا فَاذْهَبَا بِاٰيَاتِنَا اِنَّا مَعَكُمْ مُسْتَمِعُونَ) - (Allah-Təala Musanın istədiyi hər iki şeyi ona bu ayədə müxtəsər kəlamla vəd edir) **buyurur:** (ey Musa, qibtilərdən qorxma, o qorxunu səndən götürüb səni qibtilərə hakim etdim. Heç vaxt onlardan qorxma, qardaşın Haruna da peyğəmbərlik və sənə köməkçi olmasını istədin, bu istədiyini də sənə bəxş etdim. Sən və Harun) **hər ikiniz mənim möcüzələrimlə gedib** (fironu və qövmünü dəvət edin)**. Həqiqətən, mən də sizinlə birlikdəyəm və** (kəlamlarınızı) **eşidənəm.**

**16)** (فَأْتِيَا فِرْعَوْنَ فَقُولَآ اِنَّا رَسُولُ رَبِّ الْعَالَمِينَ) **- hər ikiniz fironun yanına gedin, ona deyin ki, biz aləmlərin tərbiyə verən rəbbi Allah-Təalanın peyğəmbəriyik.**

**17)** (اَنْ اَرْسِلْ مَعَنَا بَنٖي اِسْرَآءِيلَ) **- bəni-İsraildən** (əl çəkib) **bizimlə göndər,** (onları qədim məskənləri olan Fələstinə aparaq. Firon və qibtilər bəni-İsrailə həddən artıq zülm etdiklərindən əvvəlcə Allah-Təala Musaya əmr edir ki, firondan bəni-İsrailin xilas olmasını xahiş edin. Musa və Harun hər ikisi Allah-Təalanın əmri ilə fironun qapısına gedib, onların bir müddət içəri daxil olmasına izin verilmədi. Axırda qapıçı firona bildirdi ki, qapıda iki nəfər dayanıb, deyirlər ki, biz Allah-Təalanın peyğəmbərləriyik. Firon əmr etdi ki, izin verin gəlsinlər, bəlkə, onların sözlərinə istehza edib gülək. Elə ki, izin verildi, Musa və Harun fironun hüzuruna daxil olub vəhyi təbliğ etdilər. Firon da Musanı tanıdı)**.**

**18)** (قَالَ اَلَمْ نُرَبِّكَ فٖينَا وَلٖيدًا) – (firon) **dedi:** (sən o Musa deyilsən ki,) **biz sənə** (südəmər) **uşaqkən öz yanımızda tərbiyə verdik?** (Musanın fironun evində yetişdirilməsinin təfsilatı Taha surəsində keçdi). (وَلَبِثْتَ فٖينَا مِنْ عُمُرِكَ سِنٖينَ) – **ömrünün bir neçə ilini də aramızda keçirdib qalmadınmı?**

**19)** (وَفَعَلْتَ فَعْلَتَكَ الَّتٖي فَعَلْتَ وَاَنْتَ مِنَ الْكَافِرٖينَ) – (ondan sonra) **nankor olub etdiyini etdin,** (qibtini öldürüb qaçdın, indi də gəlib deyirsən ki, peyğəmbərəm, Allah tərəfindən gəlmişəm)**.**

**20)** (قَالَ فَعَلْتُهَا اِذًا وَاَنَا مِنَ الضَّآلّٖينَ) – (Musa) **dedi: "**(doğrudur o vaxt o qibtini qətlə yetirdim)**, amma bunu edərkən cahillərdən idim.** (Onun bir yumruqla öləcəyini bilsəydim, ona vurmazdım)**.**

**21)** (فَفَرَرْتُ مِنْكُمْ لَمَّا خِفْتُكُمْ) – (qibtini öldürəndən sonra) **sizdən qorxduğum üçün qaçdım.** (فَوَهَبَ لٖي رَبّٖي حُكْمًا وَجَعَلَنٖي مِنَ الْمُرْسَلٖينَ) – (sizdən qaçandan son-

وَتِلْكَ نِعْمَةٌ تَمُنُّهَا عَلَيَّ اَنْ عَبَّدْتَ بَنٖۤي اِسْرَٓاءٖيلَ ﴿٢٢﴾ قَالَ فِرْعَوْنُ وَمَا رَبُّ الْعَالَمٖينَ ﴿٢٣﴾ قَالَ
رَبُّ السَّمٰوَاتِ وَالْاَرْضِ وَمَا بَيْنَهُمَاۜ اِنْ كُنْتُمْ مُوقِنٖينَ ﴿٢٤﴾ قَالَ لِمَنْ حَوْلَهُۤ اَلَا تَسْتَمِعُونَ ﴿٢٥﴾
قَالَ رَبُّكُمْ وَرَبُّ اٰبَٓائِكُمُ الْاَوَّلٖينَ ﴿٢٦﴾ قَالَ اِنَّ رَسُولَكُمُ الَّذٖٓي اُرْسِلَ اِلَيْكُمْ لَمَجْنُونٌ ﴿٢٧﴾ قَالَ
رَبُّ الْمَشْرِقِ وَالْمَغْرِبِ وَمَا بَيْنَهُمَاۜ اِنْ كُنْتُمْ تَعْقِلُونَ ﴿٢٨﴾ قَالَ لَئِنِ اتَّخَذْتَ اِلٰهًا غَيْرٖي لَاَجْعَلَنَّكَ
مِنَ الْمَسْجُونٖينَ ﴿٢٩﴾

---

ra) **rəbbim Allah-Təala mənə hikmət verib,** (insanları dəvət etməm üçün) **peyğəmbərlərdən etdi.**

**22)** (وَتِلْكَ نِعْمَةٌ تَمُنُّهَا عَلَيَّ اَنْ عَبَّدْتَ بَنٖي اِسْرَٓاءٖيلَ) – (Musa dedi: ey firon)**, mənə minnət qoyduğun o nemət** (mənə tərbiyə vermən həqiqətən nemət deyil)**, bəni-İsraili özünə qul etməndir,** (bəni-İsrailin oğullarını öldürməsəydin, məni qorxudan suya atıb, tərbiyə almam üçün sənin yanına verməzdilər. Sənin qazancın o oldu ki, bəni-İsraili özünə qul etdin, bu bir nemətdir ki, mənə minnət qoyursan?)

**23)** (قَالَ فِرْعَوْنُ وَمَا رَبُّ الْعَالَمٖينَ) **-** (firon Musanın bu sözünə cavab tapa bilməyib ondan üz döndərdi, Musanın ilk dediyi sözü soruşdu)**, firon dedi: "Aləmlərin rəbbi nədir?"**

**24)** (قَالَ رَبُّ السَّمٰوَاتِ وَالْاَرْضِ وَمَا بَيْنَهُمَا اِنْ كُنْتُمْ مُوقِنٖينَ) – (Musa) **dedi: "Səmaların, yerin və onların arasında olan** (məxluqatın yaradıcısı və) **tərbiyə verən rəbbidir, əgər** (dəlil və sübutla) **yəqin inanansınızsa,** (bu cavab sizə fayda verər)**."**

**25)** (قَالَ لِمَنْ حَوْلَهُۤ اَلَا تَسْتَمِعُونَ) – (firon) **ətrafındakı** (vəzirlərinə) **dedi: "Eşidirsiniz?** (Deyir ki, sizi səmaları, yeri və onların arasında olan məxluqatı yaradan Allah-Təalaya dəvət edirəm, halbuki səmalar və yer qədimdir, onların xaliqi yoxdur)**."**

**26)** (قَالَ رَبُّكُمْ وَرَبُّ اٰبَٓائِكُمُ الْاَوَّلٖينَ) **-** (Musa) **dedi: "**(məni başa düşmədiniz)**. O, sizin də, əvvəlki ata-babalarınızın da** (xaliqi və tərbiyə verən) **rəbbidir."**

**27)** (قَالَ اِنَّ رَسُولَكُمُ الَّذٖي اُرْسِلَ اِلَيْكُمْ لَمَجْنُونٌ) – (firon aciz qalıb istehza ilə vəzirlərinə) **dedi: "Sizə göndərilmiş peyğəmbəriniz həqiqətən, dəlidir."**

**28)** (قَالَ رَبُّ الْمَشْرِقِ وَالْمَغْرِبِ وَمَا بَيْنَهُمَا اِنْ كُنْتُمْ تَعْقِلُونَ) **-** (Musa fironun onu dəli adlandırdığını görüb, onu səfeh sayaraq Allah-Təalanın birliyini isbat üçün belə) **dedi: "Əgər** (ağılla) **düşünsəniz** (bilərsiniz ki,) **rəbbiniz şərqin, qərbin və onların arasında olan** (məxluqatın xaliqi və) **tərbiyə verən rəbbidir."**

**29)** (قَالَ لَئِنِ اتَّخَذْتَ اِلٰهًا غَيْرٖي لَاَجْعَلَنَّكَ مِنَ الْمَسْجُونٖينَ) – (firon Musanın ona ağılsızlıq isnad etdiyini görüb qəzəblə) **dedi: "**(ey Musa)**, əgər məndən başqa bir məbud qəbul etsən, əlbəttə, səni** (həbs edib) **məhbus olanlardan edərəm."**

قَالَ اَوَلَوْ جِئْتُكَ بِشَيْءٍ مُبِينٍ ﴿٣٠﴾ قَالَ فَأْتِ بِهٖٓ اِنْ كُنْتَ مِنَ الصَّادِقِينَ ﴿٣١﴾ فَاَلْقٰى عَصَاهُ فَاِذَا
هِيَ ثُعْبَانٌ مُبِينٌۚ ﴿٣٢﴾ وَنَزَعَ يَدَهُ فَاِذَا هِيَ بَيْضَٓاءُ لِلنَّاظِرِينَ ۟ ﴿٣٣﴾ قَالَ لِلْمَلَاِ حَوْلَهُٓ اِنَّ هٰذَا لَسَاحِرٌ
عَلِيمٌۙ ﴿٣٤﴾ يُرِيدُ اَنْ يُخْرِجَكُمْ مِنْ اَرْضِكُمْ بِسِحْرِهٖۗ فَمَاذَا تَأْمُرُونَ ﴿٣٥﴾ قَالُوٓا اَرْجِهْ وَاَخَاهُ
وَابْعَثْ فِي الْمَدَٓائِنِ حَاشِرِينَۙ ﴿٣٦﴾ يَأْتُوكَ بِكُلِّ سَحَّارٍ عَلِيمٍ ﴿٣٧﴾ فَجُمِعَ السَّحَرَةُ لِمِيقَاتِ يَوْمٍ
مَعْلُومٍۙ ﴿٣٨﴾

---

**30)** (قَالَ اَوَلَوْ جِئْتُكَ بِشَيْءٍ مُبِينٍ) – (Musa) **dedi: "Əgər sənə** (haqq olduğuma dair) **açıq-aşkar bir möcüzə gətirsəm, necə?"**

**31)** (قَالَ فَأْتِ بِهٖٓ اِنْ كُنْتَ مِنَ الصَّادِقِينَ) – (firon) **dedi: "Əgər doğru deyənlərdənsənsə,** (möcüzəni) **gətir."**

**32)** (فَاَلْقٰى عَصَاهُ فَاِذَا هِيَ ثُعْبَانٌ مُبِينٌ) – (Musa) **əsasını** (yerə) **atan kimi qəfildən o, açıq-aşkar bir əjdəha oldu.** (Musanın əsası əjdəha olub öncə başını yuxarı qaldırdı, sonra firona yönəldi. Firon Musaya yalvarıb, Musa da əjdəhanı tutub, yenə əvvəlki kimi əsa oldu**).**

**33)** (وَنَزَعَ يَدَهُ فَاِذَا هِيَ بَيْضَٓاءُ لِلنَّاظِرِينَ) **-** (firon ilk möcüzəni görəndən sonra Musaya - başqa möcüzə də varındır?, dedi. Musa əlini yuxarı qaldırıb dedi: bu nədir? Firon dedi: sənin əlindir. Ondan sonra o əlini qoltuğuna saldı, necə ki ayədə buyurur: sonra) **əlini çıxardı, baxanlardan ötrü əli ağappaq** (nurlu) **oldu.**

**34)** (قَالَ لِلْمَلَاِ حَوْلَهُٓ اِنَّ هٰذَا لَسَاحِرٌ عَلِيمٌ) – (firon bu möcüzədən çaşıb, Musaya bir şey deyə bilmədi, hətta öz məbudlarına dua edib yardım istəməyi unudub) **ətrafındakı** (vəzirlərə) **dedi: "Həqiqətən, bu, bilikli bir sehrbazdır,** (sonra onlarla məşvərət etməyə başladı**).**

**35)** (يُرِيدُ اَنْ يُخْرِجَكُمْ مِنْ اَرْضِكُمْ بِسِحْرِهٖ فَمَاذَا تَأْمُرُونَ)- (firon özünün məğlub, Musanın qalib gəldiyini dərk edib ətrafındakı şəxslərə dedi:) **"bu istəyir ki, öz sehri ilə** (sizə qalib olub Misir) **torpağından sizi çıxartsın.** (Nə deyirsiniz?)"

**36)** (قَالُوٓا اَرْجِهْ وَاَخَاهُ وَابْعَثْ فِي الْمَدَٓائِنِ حَاشِرِينَ) – (vəzirlər) **dedilər: "**(Musanı) **və qardaşını bir qədər gözlət, şəhərlərə də** (adam) **yığanları göndər.**

**37)** (يَأْتُوكَ بِكُلِّ سَحَّارٍ عَلِيمٍ) – **qoy bütün bilikli sehrbazları sənin yanına gətirsinlər,** (ondan sonra bu sehrbazlarla birlikdə Musa ilə mübahisə edərsən." Firon vəzirlərin məsləhəti ilə ətraf şəhərlərdə nə qədər bilikli sehrbaz varsa, hamısını gətizdirdi**).**

**38)** (فَجُمِعَ السَّحَرَةُ لِمِيقَاتِ يَوْمٍ مَعْلُومٍ) – **nəhayət** (Musa ilə) **sehrbazlar günün müəyyən vaxtında** (bayram günü günorta) **toplandılar.**

وَقِيلَ لِلنَّاسِ هَلْ اَنْتُمْ مُجْتَمِعُونَ ﴿٣٩﴾ لَعَلَّنَا نَتَّبِعُ السَّحَرَةَ اِنْ كَانُوا هُمُ الْغَالِبِينَ ﴿٤٠﴾ فَلَمَّا جَآءَ
السَّحَرَةُ قَالُوا لِفِرْعَوْنَ اَئِنَّ لَنَا لَاَجْرًا اِنْ كُنَّا نَحْنُ الْغَالِبِينَ ﴿٤١﴾ قَالَ نَعَمْ وَاِنَّكُمْ اِذًا لَمِنَ الْمُقَرَّبِينَ
﴿٤٢﴾ قَالَ لَهُمْ مُوسٰىٓ اَلْقُوا مَآ اَنْتُمْ مُلْقُونَ ﴿٤٣﴾ فَاَلْقَوْا حِبَالَهُمْ وَعِصِيَّهُمْ وَقَالُوا بِعِزَّةِ فِرْعَوْنَ
اِنَّا لَنَحْنُ الْغَالِبُونَ ﴿٤٤﴾ فَاَلْقٰى مُوسٰى عَصَاهُ فَاِذَا هِيَ تَلْقَفُ مَا يَأْفِكُونَ ﴿٤٥﴾

---

**39)** (وَقِيلَ لِلنَّاسِ هَلْ اَنْتُمْ مُجْتَمِعُونَ) – (firon tərəfindən Misir) **xalqına deyildi: “Siz də yığılırsınız?”** (Yəni təxirə salmayıb tez orda toplanın)**.**

**40)** (لَعَلَّنَا نَتَّبِعُ السَّحَرَةَ اِنْ كَانُوا هُمُ الْغَالِبِينَ) - **əgər sehrbazlar** (Musaya) **qalib gəlsələr, bəlkə, biz də sehrbazlara tabe olub** (daha Musaya tabe olmarıq)**.**

**41)** (فَلَمَّا جَآءَ السَّحَرَةُ) – **elə ki sehrbazlar** (toplanıb fironun hüzuruna) **gəldilər,** (قَالُوا لِفِرْعَوْنَ اَئِنَّ لَنَا لَاَجْرًا اِنْ كُنَّا نَحْنُ الْغَالِبِينَ) - **firona dedilər: “Əgər** (Musaya) **qalib gəlsək, yəqin ki bizə bir mükafat olacaq?”**

**42)** (قَالَ نَعَمْ وَاِنَّكُمْ اِذًا لَمِنَ الْمُقَرَّبِينَ) – (firon) **dedi: “Bəli,** (əlbəttə sizdən ötrü bir mükafat var, əgər Musaya qalib də gəlsəniz,) **həm də mənə yaxın şəxslərdən olacaqsınız.** (Ondan sonra sehrbazlar qayıdıb Musayla üzbəüz durub dedilər: “Əvvəl sən atırsan əlindəki əsanı, ya biz ataq öz şeylərimizi?”)

**43)** (قَالَ لَهُمْ مُوسٰىٓ اَلْقُوا مَآ اَنْتُمْ مُلْقُونَ) - **Musa onlara dedi: “Nə atacaqsınızsa, atın.”**

**44)** (فَاَلْقَوْا حِبَالَهُمْ وَعِصِيَّهُمْ) – (sehrbazlar) **iplərini və əsalarını** (ortaya) **atdılar.** (وَقَالُوا بِعِزَّةِ فِرْعَوْنَ اِنَّا لَنَحْنُ الْغَالِبُونَ) – (sonra and içib) **dedilər: “Fironun izzətinə and olsun ki,* əlbəttə, biz qalib gələcəyik.”**

*(*__Qeyd:__ Görüldüyü kimi, sehrbazlar cahiliyyə adəti ilə and içdilər, Allah-Təaladan başqa nəyə and içilsə, o and cahiliyyə andıdır. İslamda Allah-Təaladan başqasına and içmək caiz deyildir. O da ancaq haqq və gərəkli olan məqamda and içilər, yoxsa nəinki hər boş şeydən ötrü. Necə ki bizim bu zamanda həqir dünya malını alıb satmaqdan ötrü Allah-Təalaya and içmək dinin fərzi kimi olubdur. Özü də Allah-Təalaya and içildikdə qəbul edilmir, amma imama, övliyaya, şəhidlərə, ya da o şəxsin atasının, anasının məzarı üstünə and içildikdə, düşünmədən o andı qəbul edib səni təsdiq edərlər. Halbuki islam şəriətində Allah-Təaladan başqasına and içmək küfr və batildir. (Tirmizi, Nüzur 9; Nəsai, Əyman 4) Uca Peyğəmbərimiz buyurubdur: “Atanıza və ananıza, başqa batil şeylərə and içməyin, ancaq Allah-Təalaya and için. Onu da ancaq sözünüzdə sadiq olduqda edin.” (Buxari, Əyman 4; Müslüm, Əyman 1; Əbu Davud, Əyman 5) Müsəlmanların içdiyi bəzi andlara cahiliyyə əməli demək daha doğrudur).*

**45)** (فَاَلْقٰى مُوسٰى عَصَاهُ فَاِذَا هِيَ تَلْقَفُ مَا يَأْفِكُونَ) - **Musa** (onların qarşısında) **əsasını atdı, o da dərhal** (əjdəha olub onların sehrbazlıqla) **uydurduqları şeyləri uddu.**

فَاُلْقِيَ السَّحَرَةُ سَاجِدِينَ ﴿٤٦﴾ قَالُوٓا اٰمَنَّا بِرَبِّ الْعَالَمِينَ ﴿٤٧﴾ رَبِّ مُوسٰى وَهٰرُونَ ﴿٤٨﴾ قَالَ
اٰمَنْتُمْ لَهُ قَبْلَ اَنْ اٰذَنَ لَكُمْ اِنَّهُ لَكَبِيرُكُمُ الَّذ۪ي عَلَّمَكُمُ السِّحْرَ فَلَسَوْفَ تَعْلَمُونَ لَاُقَطِّعَنَّ اَيْدِيَكُمْ
وَاَرْجُلَكُمْ مِنْ خِلَافٍ وَلَاُصَلِّبَنَّكُمْ اَجْمَع۪ينَ ﴿٤٩﴾ قَالُوا لَا ضَيْرَ اِنَّٓا اِلٰى رَبِّنَا مُنْقَلِبُونَ ﴿٥٠﴾ اِنَّا
نَطْمَعُ اَنْ يَغْفِرَ لَنَا رَبُّنَا خَطَايَانَٓا اَنْ كُنَّٓا اَوَّلَ الْمُؤْمِن۪ينَ ﴿٥١﴾ وَاَوْحَيْنَٓا اِلٰى مُوسٰٓى اَنْ اَسْرِ بِعِبَاد۪ٓي
اِنَّكُمْ مُتَّبَعُونَ ﴿٥٢﴾ فَاَرْسَلَ فِرْعَوْنُ فِي الْمَدَٓائِنِ حَاشِر۪ينَ ﴿٥٣﴾

---

**46)** (فَاُلْقِيَ السَّحَرَةُ سَاجِد۪ينَ) – (Musanın haqq olduğu sehrbazlara məlum olduqda)**, hamısı üzü üstə yıxılıb** (Allah-Təalaya) **səcdə etdilər.**

**47)** (قَالُوٓا اٰمَنَّا بِرَبِّ الْعَالَم۪ينَ) – (səcdə edib) **dedilər: "Aləmlərin tərbiyə verən rəbbi Allah-Təalaya iman gətirdik.**

**48)** (رَبِّ مُوسٰى وَهٰرُونَ) **- o Allah-Təala ki Musa və Harunun tərbiyə verən rəbbidir."**

**49)** (قَالَ اٰمَنْتُمْ لَهُ قَبْلَ اَنْ اٰذَنَ لَكُمْ) – (firon qəzəblənib sehrbazlara) **dedi: "Mən sizə izin verməmiş** (Musaya) **iman gətirdiniz,** (اِنَّهُ لَكَب۪يرُكُمُ الَّذ۪ي عَلَّمَكُمُ السِّحْرَ فَلَسَوْفَ تَعْلَمُونَ) **- həqiqətən,** (Musa) **sizə sehr öyrətmiş böyüyünüzdür,** (tezliklə nə əzaba düçar olacağınızı) **şübhəsiz ki, biləcəksiniz.** (لَاُقَطِّعَنَّ اَيْدِيَكُمْ وَاَرْجُلَكُمْ مِنْ خِلَافٍ) **- əlbəttə, əllərinizi və ayaqlarınızı çarpaz** (birini sağdan, birini soldan) **kəsdirəcəyəm.** (وَلَاُصَلِّبَنَّكُمْ اَجْمَع۪ينَ) – (ondan sonra) **əlbəttə, hamınızı** (boğazınızdan) **asdırırıb** (həlak edəcəyəm)**.**

**50)** (قَالُوا لَا ضَيْرَ اِنَّٓا اِلٰى رَبِّنَا مُنْقَلِبُونَ) – (sehrbazlar) **dedilər:** (sənin bizi qətlə yetirməyinin) **bizə heç bir zərəri yoxdur. Həqiqətən,** (sən bizi qətlə yetirəndən sonra) **biz öz rəbbimiz Allah-Təalaya dönəcəyik,** (O da günahlarımızı bağışlayıb bizə böyük əcr və savablar bəxş edəcəkdir)**.**

**51)** (اِنَّا نَطْمَعُ اَنْ يَغْفِرَ لَنَا رَبُّنَا خَطَايَانَٓا اَنْ كُنَّٓا اَوَّلَ الْمُؤْمِن۪ينَ) **- həqiqətən, ümid edirik ki,** (Musaya) **ilk iman gətirənlərdən olduğumuzdan rəbbimiz Allah-Təala günahlarımızı bağışlasın.** (Ondan sonra fironun əmri ilə o sehrbazları qətlə yetirdilər)**.**

**52)** (وَاَوْحَيْنَٓا اِلٰى مُوسٰٓى اَنْ اَسْرِ بِعِبَاد۪ٓي اِنَّكُمْ مُتَّبَعُونَ) – (firon və ona tabe olanlar Musaya müxalif olub iman gətirmədikdə) **Musaya vəhy edib dedik:** (ey Musa)**, mənim bəndələrimlə** (bəni-İsraillə) **gecə vaxtı** (Misirdən) **çıx. Həqiqətən,** (firon və qoşunu) **dalınızca gələcəklər.** (Musa Allah-Təalanın əmrinə itaət edib gecə vaxtı bəni-İsraili götürüb Misirdən çıxdı)**.**

**53)** (فَاَرْسَلَ فِرْعَوْنُ فِي الْمَدَٓائِنِ حَاشِر۪ينَ) – (bəni-İsrailin Misirdən getdiyindən xəbərdar olduqda)**, firon şəhərlərə** (qoşun) **yığanları göndərdi.**

اِنَّ هٰٓؤُلَٓاءِ لَشِرْذِمَةٌ قَلِيلُونَۙ ﴿٥٤﴾ وَاِنَّهُمْ لَنَا لَغَٓائِظُونَۙ ﴿٥٥﴾ وَاِنَّا لَجَمِيعٌ حَاذِرُونَۙ ﴿٥٦﴾
فَاَخْرَجْنَاهُمْ مِنْ جَنَّاتٍ وَعُيُونٍۙ ﴿٥٧﴾ وَكُنُوزٍ وَمَقَامٍ كَرِيمٍۙ ﴿٥٨﴾ كَذٰلِكَۜ وَاَوْرَثْنَاهَا بَن۪ٓي اِسْرَٓاءِيلَۜ
﴿٥٩﴾ فَاَتْبَعُوهُمْ مُشْرِق۪ينَ ﴿٦٠﴾ فَلَمَّا تَرَٓاءَ الْجَمْعَانِ قَالَ اَصْحَابُ مُوسٰٓى اِنَّا لَمُدْرَكُونَۚ ﴿٦١﴾
قَالَ كَلَّاۚ اِنَّ مَعِيَ رَبّ۪ي سَيَهْد۪ينِ ﴿٦٢﴾ فَاَوْحَيْنَٓا اِلٰى مُوسٰٓى اَنِ اضْرِبْ بِعَصَاكَ الْبَحْرَۜ فَانْفَلَقَ فَكَانَ
كُلُّ فِرْقٍ كَالطَّوْدِ الْعَظ۪يمِۚ ﴿٦٣﴾

---

**54)** (اِنَّ هٰٓؤُلَٓاءِ لَشِرْذِمَةٌ قَلِيلُونَ) – (göndərdiyi şəxslərə əmr etdi ki, camaata belə deyin:) **bu** (bəni- İsrail sayca) **az olan camaatdır.**

**55)** (وَاِنَّهُمْ لَنَا لَغَٓائِظُونَ) **- amma həqiqətən,** (onların əməlləri və buradan qaçmaları) **bizi qəzəbləndiribdir.**

**56)** (وَاِنَّا لَجَمِيعٌ حَاذِرُونَ) – **biz isə** (düşmənə qarşı ehtiyatlı)**, ayıq-sayıq bir camaatıq,** (gərək, onların fəsadını yer üzündən tez silək. Fironun bəni-İsraili sayca az olaraq göstərməsi onları zəif göstərib, öz camaatını onlara qarşı savaşa ürəkləndirmək üçündür. Ondan sonra qoşunu toplayıb Musanın dalınca getdilər. Allah-Təala onların Misirdən çıxmasını özünə isnad edir. Necə ki bundan sonra gələn ayədə zikr olunur)**.**

**57)** (فَاَخْرَجْنَاهُمْ مِنْ جَنَّاتٍ وَعُيُونٍ) – (firon və qövmü olan qibtiləri Misirin) **gözəl bağlarından və bulaqlarından çıxartdıq.**

**58)** (وَكُنُوزٍ وَمَقَامٍ كَرِيمٍ) – (yenə onları Misirin) **xəzinələrindən gözəl yerlərindən** (birdəfəlik çıxartdıq, bir də geri dönə bilməzlər)**.**

**59)** (كَذٰلِكَ وَاَوْرَثْنَاهَا بَن۪ٓي اِسْرَٓاءِيلَ) – **beləliklə** (qibtiləri Misirdən çıxarıb dənizdə qərq edəndən sonra) **bəni-İsraili onlara varis etdik.**

**60)** (فَاَتْبَعُوهُمْ مُشْرِق۪ينَ) – **günəş doğduqda,** (firon qoşunuyla bəni-İsrailin) **arxasınca düşdülər.**

**61)** (فَلَمَّا تَرَٓاءَ الْجَمْعَانِ قَالَ اَصْحَابُ مُوسٰٓى اِنَّا لَمُدْرَكُونَ) **- iki dəstə** (Musa və fironun dəstəsi) **bir-birilərini gördükdə, Musanın camaatı** (bəni-İsrail) **dedi: artıq** (firon tərəfindən) **yaxalandıq,** (onun qoşununun qarşısında durmağa gücümüz yoxdur)**.**

**62)** (قَالَ كَلَّا اِنَّ مَعِيَ رَبّ۪ي سَيَهْد۪ينِ) – (Musa) **dedi: "Xeyr,** (bizi yaxalaya bilməzlər)**, həqiqətən, rəbbim Allah-Təala mənimlədir,** (mənə kömək edib) **nicat yolunu göstərər."**

**63)** (فَاَوْحَيْنَٓا اِلٰى مُوسٰٓى اَنِ اضْرِبْ بِعَصَاكَ الْبَحْرَ) – (fironun qoşunu bəni-İsrailə yaxınlaşanda)**, biz vəhy edib Musaya dedik: "**(ey Musa)**, əsanla dənizə vur."** (فَانْفَلَقَ فَكَانَ كُلُّ فِرْقٍ كَالطَّوْدِ الْعَظ۪يمِ) – (Musa Allah-Təalanın əmriylə əsanı dənizə

وَاَزْلَفْنَا ثَمَّ الْاٰخَرِينَۚ ﴿٦٤﴾ وَاَنْجَيْنَا مُوسٰى وَمَنْ مَعَهُۥٓ اَجْمَعِينَۚ ﴿٦٥﴾ ثُمَّ اَغْرَقْنَا الْاٰخَرِينَ ﴿٦٦﴾
اِنَّ فِي ذٰلِكَ لَاٰيَةًۜ وَمَا كَانَ اَكْثَرُهُمْ مُؤْمِنِينَ ﴿٦٧﴾ وَاِنَّ رَبَّكَ لَهُوَ الْعَزِيزُ الرَّحِيمُۜ ﴿٦٨﴾ وَاتْلُ عَلَيْهِمْ
نَبَاَ اِبْرٰهِيمَۢ ﴿٦٩﴾ اِذْ قَالَ لِاَبِيهِ وَقَوْمِهِ مَا تَعْبُدُونَ ﴿٧٠﴾ قَالُوا نَعْبُدُ اَصْنَامًا فَنَظَلُّ لَهَا عَاكِفِينَ
﴿٧١﴾ قَالَ هَلْ يَسْمَعُونَكُمْ اِذْ تَدْعُونَۙ ﴿٧٢﴾ اَوْ يَنْفَعُونَكُمْ اَوْ يَضُرُّونَ ﴿٧٣﴾ قَالُوا بَلْ وَجَدْنَٓا
اٰبَٓاءَنَا كَذٰلِكَ يَفْعَلُونَ ﴿٧٤﴾

---

vuran kimi dəniz) **aralandı,** (bəni-İsrailin 12 tayfasından ötrü 12 yol açıldı, sular bir-birinin üstünə cəm olub) **hər hissə uca dağ kimi oldu.**

**64)** (وَاَزْلَفْنَا ثَمَّ الْاٰخَرِينَ) – (bəni-İsrail dənizə daxil olandan sonra fironun camaatını da) **onlara yaxınlaşdırdıq.** (Firon qürurundan qayıda bilməyib dedi: dəniz mənim qüdrətimdən qorxub bir-birindən aralanıb, dənizə girib, qibtilər də ona tabe olub, dənizə daxil oldular)**.**

**65)** (وَاَنْجَيْنَا مُوسٰى وَمَنْ مَعَهُۥٓ اَجْمَعِينَ) – **Musaya və onunla birlikdə olanların hamısını** (dənizdən) **xilas etdik.**

**66)** (ثُمَّ اَغْرَقْنَا الْاٰخَرِينَ) – (onlara nicat verəndən sonra fironun özünü və camaatını dənizdə) **qərq etdik.**

**67)** (اِنَّ فِي ذٰلِكَ لَاٰيَةً وَمَا كَانَ اَكْثَرُهُمْ مُؤْمِنِينَ) **- həqiqətən,** (dənizin aralanıb, Musa və bəni-İsrailin nicat tapıb, firon və onun qövmünün həlak olmasında Allah-Təalanın tövhid və qüdrətinə) **dəlil və sübutlar vardır, amma** (insanların) **çoxu** (dəlilə baxıb Allah-Təalaya) **iman gətirən deyil.**

**68)** (وَاِنَّ رَبَّكَ لَهُوَ الْعَزِيزُ الرَّحِيمُ) **- həqiqətən,** (ey Məhəmməd)**, sənin rəbbin Allah-Təala qalib olub** (müşriklərdən intiqam alandır və tövbə edib saleh əməl edənləri) **rəhm edib** (bağışlayandır)**.**

**69-70)** (وَاتْلُ عَلَيْهِمْ نَبَاَ اِبْرٰهِيمَ اِذْ قَالَ لِاَبِيهِ وَقَوْمِهِ مَا تَعْبُدُونَ) - (ey Məhəmməd, müşriklərə) **İbrahimin qissəsini zikr et, o zaman ki atasına, qövmünə nəyə ibadət edirsiniz? – demişdi.**

**71)** (قَالُوا نَعْبُدُ اَصْنَامًا فَنَظَلُّ لَهَا عَاكِفِينَ) - (İbrahimin cavabında) **dedilər: "Bütlərə ibadət edib,** (səhər-axşam) **onların ibadətinə davam edirik."**

**72)** (قَالَ هَلْ يَسْمَعُونَكُمْ اِذْ تَدْعُونَ) – (İbrahim) **dedi: "Siz o bütləri çağırdığınızda sizi eşidirlər.**

**73)** (اَوْ يَنْفَعُونَكُمْ اَوْ يَضُرُّونَ) **- ya da sizə bir mənfəət, ya da bir zərər verə bilirlər?"**

**74)** (قَالُوا بَلْ وَجَدْنَٓا اٰبَٓاءَنَا كَذٰلِكَ يَفْعَلُونَ) – (müşriklər İbrahimin qarşısında aciz qalıb təqlidçilər kimi cavab verib) **dedilər:** (bu bütlər bir söz eşidən, mənfəət

قَالَ اَفَرَاَيْتُمْ مَا كُنْتُمْ تَعْبُدُونَۙ ﴿٧٥﴾ اَنْتُمْ وَاٰبَٓاؤُ۬كُمُ الْاَقْدَمُونَ ﴿٧٦﴾ فَاِنَّهُمْ عَدُوٌّ لّ۪يٓ اِلَّا رَبَّ الْعَالَم۪ينَۙ ﴿٧٧﴾ اَلَّذ۪ي خَلَقَن۪ي فَهُوَ يَهْد۪ينِۙ ﴿٧٨﴾ وَالَّذ۪ي هُوَ يُطْعِمُن۪ي وَيَسْق۪ينِۙ ﴿٧٩﴾ وَاِذَا مَرِضْتُ فَهُوَ يَشْف۪ينِۖ ﴿٨٠﴾ وَالَّذ۪ي يُم۪يتُن۪ي ثُمَّ يُحْي۪ينِۙ ﴿٨١﴾ وَالَّذ۪ٓي اَطْمَعُ اَنْ يَغْفِرَ ل۪ي خَط۪ٓيـَٔت۪ي يَوْمَ الدّ۪ينِۜ ﴿٨٢﴾

---

və zərər verən deyildir), **bəlkə ata-babalarımızı belə** (ibadət) **edən görüb,** (biz də onlar kimi bu bütlərə ibadət edirik. Bu ayə dini məsələlərdə təqlidçilik etməyin batil olduğuna işarədir və qınanmışdır. Bir dinə inanmaq, gərək, dəlil və sübut üzrə olsun)**.**

**75-76)** (قَالَ اَفَرَاَيْتُمْ مَا كُنْتُمْ تَعْبُدُونَ اَنْتُمْ وَاٰبَٓاؤُ۬كُمُ الْاَقْدَمُونَ) – (İbrahim) **dedi: sizin və ulu babalarınızın nəyə ibadət etdiyini gördünüzmü?** (Təqlidlə bu bütlərə ibadət etməyiniz onların haqq olduğuna işarə edərmi? Əvvəlkilərin də bu bütlərə ibadət etməsi onların haqq olduğuna işarə etməz)**.**

**77)** (فَاِنَّهُمْ عَدُوٌّ لّ۪يٓ اِلَّا رَبَّ الْعَالَم۪ينَ) - **aləmlərə tərbiyə verən rəbb Allah-Təaladan başqa** (bütlərin hamısı) **mənim düşmənimdir.** (Mən onlara necə ibadət edərəm? (Allah-Təala bütün insanları yaradıb onların tərbiyə verən rəbbi olduğundan, mən o bütlərə düşmən olduğum kimi, gərək siz də onlara düşmən olub ibadət etməyəsiniz)**.**

**78)** (اَلَّذ۪ي خَلَقَن۪ي فَهُوَ يَهْد۪ينِ) – (Allah-Təalanın sifətlərindən biri də) **odur ki, məni** (ananın rəhmində) **yaradıb** (ruh verəndən sonra bu dünyaya gətirib kamil bir insan edib və mənə lazım olan hər bir şeyin yolunu mənə göstərib) **hidayət edibdir.**

**79)** (وَالَّذ۪ي هُوَ يُطْعِمُن۪ي وَيَسْق۪ينِ) – (Allah-Təalanın sifətlərindən biri də) **odur ki, lütf edib məni yedirdir və içirdir,** (aclıqdan və susuzluqdan məni mühafizə edir)**.**

**80)** (وَاِذَا مَرِضْتُ فَهُوَ يَشْف۪ينِ) – **xəstələndiyimdə, ancaq** (Allah-Təala) **mənə şəfa verir.** (Hz. İbrahim hər bir şeyi Allah-Təalaya isnad etdi, amma xəstəlik insanın öz yemək-içməyində ifrata varmasından hasil olduğundan xəstəliyi özünə isnad etdi)**.**

**81)** (وَالَّذ۪ي يُم۪يتُن۪ي ثُمَّ يُحْي۪ينِ) – (Allah-Təalanın sifətlərindən biri də) **odur ki, məni öldürüb ondan sonra dirildib** (qiyamət günündə məhşərə götürəcək)**.**

**82)** (وَالَّذ۪ٓي اَطْمَعُ اَنْ يَغْفِرَ ل۪ي خَط۪ٓيـَٔت۪ي يَوْمَ الدّ۪ينِ) – (Allah-Təalanın sifətlərindən biri də) **odur ki, qiyamət günü xəta və günahlarımı bağışlayacağını ümid edirəm.** (Bu zikr olunan şeylərin hamısı Allah-Təalaya məxsusdur. Bəs sizin ibadət etdiyiniz bütlər bu şeyləri edə bilər və onların bunları edəcəyinə ümid

رَبِّ هَبْ لِي حُكْمًا وَاَلْحِقْنِي بِالصَّالِحِينَۙ ﴿٨٣﴾ وَاجْعَلْ لِي لِسَانَ صِدْقٍ فِي الْاٰخِرِينَۙ ﴿٨٤﴾ وَاجْعَلْنِي
مِنْ وَرَثَةِ جَنَّةِ النَّعِيمِۙ ﴿٨٥﴾ وَاغْفِرْ لِاَبِيٓ اِنَّهُ كَانَ مِنَ الضَّٓالّ۪ينَۙ ﴿٨٦﴾ وَلَا تُخْزِنِي يَوْمَ يُبْعَثُونَۙ ﴿٨٧﴾ يَوْمَ
لَا يَنْفَعُ مَالٌ وَلَا بَنُونَۙ ﴿٨٨﴾ اِلَّا مَنْ اَتَى اللّٰهَ بِقَلْبٍ سَل۪يمٍۜ ﴿٨٩﴾ وَاُزْلِفَتِ الْجَنَّةُ لِلْمُتَّق۪ينَۙ ﴿٩٠﴾

---

etmək olarmı? Hz. İbrahim müşriklərə xitab edib qurtarandan sonra özündən ötrü dua edib Allah-Təaladan gözəl şeylər xahiş etməyə başladı).

**83)** (رَبِّ هَبْ لِي حُكْمًا وَاَلْحِقْنِي بِالصَّالِحِينَ) - (İbrahimin duası belədir:) **ey mənim rəbbim,** (öz lütf və rəhmətindən) **mənə hikmət** (hər bir şeyin həqiqətini dərk etmə gücü) **bəxş et, məni saleh şəxslərə qovuşdur.**

**84)** (وَاجْعَلْ لِي لِسَانَ صِدْقٍ فِي الْاٰخِرِينَ) – (ey mənim rəbbim, məndən) **sonra gələn ümmətlərin arasında mənə yaxşı ad** (həmd-səna) **qismət et** (ki, məni sevib yaxşı sifətlərlə yad etsinlər. Allah-Təala Hz. İbrahimin bu duasını qəbul edib hər bir səmavi din mənsubu onu sevib, özünü onun dininə nisbət etməklə fəxr edir).

**85)** (وَاجْعَلْنِي مِنْ وَرَثَةِ جَنَّةِ النَّعِيمِ) – **məni əbədi cənnətin varislərindən et.**

**86)** (وَاغْفِرْ لِاَبِي اِنَّهُ كَانَ مِنَ الضَّٓالّ۪ينَ) – (ey mənim rəbbim), **atamı bağışla, həqiqətən, mənim atam** (asi olub haqq yolundan) **azanlardandır.** (Hz. İbrahim atasına vəd etdiyi üçün bu ayədə Allah-Təaladan onun bağışlanmasını dilədi. Necə ki bu mətləb Tövbə surəsində zikr olundu. Amma atası müşrik olduğundan Hz. İbrahimin bu duası qəbul olunmayıb rədd edildi. Hz. İbrahim də vədinə sadiq qalandan sonra atasının iman edəcəyindən ümidsizləşib ondan üz döndərdi).

**87)** (وَلَا تُخْزِنِي يَوْمَ يُبْعَثُونَ) – (ey mənim rəbbim, məhşər) **günü insanlar dirildilib** (toplandığında atamı asilərin arasında qoymaqla) **məni zəlil və rüsvay etmə.** (Allah-Təala Hz. İbrahim kimi şəxsin bu cür yalvarıb dua etməsinə etina etməyib atasını bağışlamadı. Bizim islam ümməti isə öz xəyallarıyla uydurub özlərindən ötrü şəfaətçi saydıqları şeylərə aldanıb özlərini cənnət əhli hesab edib hər bir qəbih əmələ qurşanırlar).

**88)** (يَوْمَ لَا يَنْفَعُ مَالٌ وَلَا بَنُونَ) - (Hz. İbrahim yenə müşriklərə deyir: qiyamət günü) **elə bir gündür ki, nə mal, nə də oğullar** (hansı ki onlarla iftixar edirsiniz, sizə) **mənfəət verməz.**

**89)** (اِلَّا مَنْ اَتَى اللّٰهَ بِقَلْبٍ سَل۪يمٍ) - **ancaq** (qiyamət günü Allah-Təalanın hüzuruna küfr və şirkdən arınmış) **sağlam qəlblə gələn istisnadır,** (o qəlbin paklığı ona fayda verər).

**90)** (وَاُزْلِفَتِ الْجَنَّةُ لِلْمُتَّق۪ينَ) – (qiyamət günü) **cənnət müttəqilərə yaxınlaşdırılar.** (Cənnətdəki mənzil və məqamlarına baxıb şad olarlar).

وَبُرِّزَتِ الْجَحِيمُ لِلْغَاوِينَۙ ﴿٩١﴾ وَقِيلَ لَهُمْ اَيْنَ مَا كُنْتُمْ تَعْبُدُونَۙ ﴿٩٢﴾ مِنْ دُونِ اللّٰهِؕ هَلْ يَنْصُرُونَكُمْ
اَوْ يَنْتَصِرُونَؕ ﴿٩٣﴾ فَكُبْكِبُوا فِيهَا هُمْ وَالْغَاوُنَۙ ﴿٩٤﴾ وَجُنُودُ اِبْلِيسَ اَجْمَعُونَؕ ﴿٩٥﴾ قَالُوا وَهُمْ
فِيهَا يَخْتَصِمُونَۙ ﴿٩٦﴾ تَاللّٰهِ اِنْ كُنَّا لَفِي ضَلَالٍ مُبِينٍۙ ﴿٩٧﴾ اِذْ نُسَوِّيكُمْ بِرَبِّ الْعَالَمِينَ ﴿٩٨﴾ وَمَٓا
اَضَلَّنَٓا اِلَّا الْمُجْرِمُونَ ﴿٩٩﴾ فَمَا لَنَا مِنْ شَافِعِينَۙ ﴿١٠٠﴾ وَلَا صَدِيقٍ حَمِيمٍ ﴿١٠١﴾ فَلَوْ اَنَّ لَنَا
كَرَّةً فَنَكُونَ مِنَ الْمُؤْمِنِينَ ﴿١٠٢﴾

---

**91)** (وَبُرِّزَتِ الْجَحِيمُ لِلْغَاوِينَ) – **asilərdən ötrü cəhənnəm aşkar olar.** (Onu görməklə həsrət və peşmanlıqları artıb, hər cür qəm-qüssəyə düçar olarlar)**.**

**92-93)** (وَقِيلَ لَهُمْ اَيْنَ مَا كُنْتُمْ تَعْبُدُونَ مِنْ دُونِ اللّٰهِ) – (qiyamət günü müşriklərə) **deyilər: Allah-Təaladan başqa ibadət etdiyiniz bütləriniz hardadır?** (هَلْ يَنْصُرُونَكُمْ اَوْ يَنْتَصِرُونَ) – (o bütlərin) **sizə kömək etməyə, ya da** (öz intiqamlarını alıb) **özlərinə mənfəət verməyə qüdrətləri varmı?**

**94)** (فَكُبْكِبُوا فِيهَا هُمْ وَالْغَاوُنَ) – (o batil bütlər və onlara tabe olan) **asilərin hamısı** (bir-birinin dalınca başları üstə cəhənnəmə) **atılar.**

**95)** (وَجُنُودُ اِبْلِيسَ اَجْمَعُونَ) **- şeytanın** (xəbis nəfsi-əmmarənin) **bütün qoşunu** (və ona tabe olanlar da cəhənnəmə) **atılar.**

**96)** (قَالُوا وَهُمْ فِيهَا يَخْتَصِمُونَ) – (cəhənnəmə daxil olan kafirlər və məbudları) **bir-biriləriylə mübahisə edib,** (kafirlər öz məbudlarına) **deyər:**

**97)** (تَاللّٰهِ اِنْ كُنَّا لَفِي ضَلَالٍ مُبِينٍ) **- and olsun Allah-Təalaya,** (sizə ibadət etmək-lə) **həqiqətən, açıq-aşkar zəlalətdə olmuşuq.**

**98)** (اِذْ نُسَوِّيكُمْ بِرَبِّ الْعَالَمِينَ) **- o zaman** (sizə sitayiş etməklə) **aləmlərə tərbiyə verən rəbb Allah-Təalaya sizi bərabər tutmuşduq.**

**99)** (وَمَٓا اَضَلَّنَٓا اِلَّا الْمُجْرِمُونَ) – **bizi ancaq** (Allah-Təalaya asi olan) **günahkar** (böyüklərimiz) **zəlalətə saldı.**

**100)** (فَمَا لَنَا مِنْ شَافِعِينَ) – (bugünkü gündə) **bizdən ötrü heç bir şəfaət edən yoxdur,** (necə ki peyğəmbərlər və mələklər Allah-Təalanın izniylə mömin-lərdən ötrü şəfaət etdi)**.**

**101)** (وَلَا صَدِيقٍ حَمِيمٍ) **- bir mehriban dostumuz da yoxdur** (ki, bu gün bizə kömək edib əzabdan qurtarsın)**.**

**102)** (فَلَوْ اَنَّ لَنَا كَرَّةً فَنَكُونَ مِنَ الْمُؤْمِنِينَ) **- kaş bir dəfə də** (dünyaya) **qayıdıb,** (Allah-Təalaya və peyğəmbərlərə tabe olan) **möminlərdən olaydıq.** (Belə ki, belə bir günün əzabından qurtulub xilas olaydıq. Burada Hz. İbrahimin sözü bitdi. Hz. İbrahimin müşriklərə necə gözəl xitab etdiyi burada nümunə göstə-rilmişdir, bu, ağıllı şəxslərə məxfi deyildir)**.**

اِنَّ فِي ذٰلِكَ لَاٰيَةً وَمَا كَانَ اَكْثَرُهُمْ مُؤْمِنِينَ ﴿١٠٣﴾ وَاِنَّ رَبَّكَ لَهُوَ الْعَزِيزُ الرَّحِيمُ ﴿١٠٤﴾ كَذَّبَتْ
قَوْمُ نُوحٍ الْمُرْسَلِينَ ﴿١٠٥﴾ اِذْ قَالَ لَهُمْ اَخُوهُمْ نُوحٌ اَلَا تَتَّقُونَ ﴿١٠٦﴾ اِنِّي لَكُمْ رَسُولٌ اَمِينٌ
﴿١٠٧﴾ فَاتَّقُوا اللّٰهَ وَاَطِيعُونِ ﴿١٠٨﴾ وَمَٓا اَسْـَٔلُكُمْ عَلَيْهِ مِنْ اَجْرٍ اِنْ اَجْرِيَ اِلَّا عَلٰى رَبِّ الْعَالَمِينَ
﴿١٠٩﴾ فَاتَّقُوا اللّٰهَ وَاَطِيعُونِ ﴿١١٠﴾ قَالُوٓا اَنُؤْمِنُ لَكَ وَاتَّبَعَكَ الْاَرْذَلُونَ ﴿١١١﴾

---

**103)** (اِنَّ فِي ذٰلِكَ لَاٰيَةً وَمَا كَانَ اَكْثَرُهُمْ مُؤْمِنِينَ) **- həqiqətən,** (Hz. İbrahimin əhvalatında Allah-Təalanın tövhidinə dair) **dəlil və sübutlar var, amma** (insanların) **əksəriyyəti** (bu dəlillərə baxıb Allah-Təalaya) **iman gətirən deyil.**

**104)** (وَاِنَّ رَبَّكَ لَهُوَ الْعَزِيزُ الرَّحِيمُ) - (ey Məhəmməd)**, həqiqətən, sənin rəbbin müşriklərə qalib olub** (intiqam alandır və tövbəkar olub saleh əməl edən şəxsləri) **rəhm edib** (bağışlayandır)**.**

**105)** (كَذَّبَتْ قَوْمُ نُوحٍ الْمُرْسَلِينَ) **- Nuh** (peyğəmbərin) **qövmü** (Nuhun özünü və ondan əvvəl Allah-Təala tərəfindən göndərilən) **peyğəmbərləri təkzib etdilər.**

**106)** (اِذْ قَالَ لَهُمْ اَخُوهُمْ نُوحٌ اَلَا تَتَّقُونَ) **– o zaman ki qardaşları* Nuh onlara dedi: "Bəs Allah-Təaladan qorxub** (şirk qoşmağı tərk etməyəcəksinizmi?)

*(*Qeyd: Nuh o camaatdan olduğundan Allah-Təala ona onların qardaşı deyir. Habelə bundan sonra zikr olunan peyğəmbərlərə də elə xitab edir, ancaq Şüeyb peyğəmbər iki camaata göndərilib, onlardan biri Eykə camaatıdır, Şüeyb o camaatdan olmadığından ona onların qardaşı demir. Digəri Mədyən camaatıdır, Şüeyb özü Mədyən camaatından olduğundan ona qardaş deyə xitab edilir).*

**107)** (اِنِّي لَكُمْ رَسُولٌ اَمِينٌ) **- həqiqətən, mən sizə** (Allah-Təala tərəfindən göndərilən) **əmin bir peyğəmbərəm.** (Hz. Məhəmməd (ə.s), Qüreyş arasında əminliyi ilə məşhur olduğu kimi, Nuh (ə.s),-da öz qövmünün arasında bu cür məşhur idi)**.**

**108)** (فَاتَّقُوا اللّٰهَ وَاَطِيعُونِ) – (Allah-Təalanın əzabından) **qorxub mənə itaət edin.**

**109)** (وَمَٓا اَسْـَٔلُكُمْ عَلَيْهِ مِنْ اَجْرٍ) – (sizi Allah-Təalaya dəvət etməkdən ötrü etdiyim nəsihət üçün) **sizdən bir əcr və mükafat istəmirəm.** (اِنْ اَجْرِيَ اِلَّا عَلٰى رَبِّ الْعَالَمِينَ) **- mənim əcr və mükafatım ancaq aləmlərə tərbiyə verən rəbb Allah-Təalaya aiddir.**

**110)** (فَاتَّقُوا اللّٰهَ وَاَطِيعُونِ) **– Allah-Təaladan qorxub mənə itaət edin.** (Şirki tərk etmələri üçün bu kəlamı təkrar etdi)**.**

**111)** (قَالُوٓا اَنُؤْمِنُ لَكَ وَاتَّبَعَكَ الْاَرْذَلُونَ) **dedilər:** (ey Nuh)**, biz sənə inanıb** (tabe olaq?)**, halbuki sənə** (bizim aramızda adsız, dünya malı olmayan) **alçaq şəxs-**

قَالَ وَمَا عِلْمِي بِمَا كَانُوا يَعْمَلُونَۚ ﴿١١٢﴾ اِنْ حِسَابُهُمْ اِلَّا عَلٰى رَبِّي لَوْ تَشْعُرُونَۚ ﴿١١٣﴾ وَمَٓا
اَنَا بِطَارِدِ الْمُؤْمِنِينَۚ ﴿١١٤﴾ اِنْ اَنَا اِلَّا نَذِيرٌ مُبِينٌۜ ﴿١١٥﴾ قَالُوا لَئِنْ لَمْ تَنْتَهِ يَا نُوحُ لَتَكُونَنَّ مِنَ
الْمَرْجُومِينَۜ ﴿١١٦﴾ قَالَ رَبِّ اِنَّ قَوْمِي كَذَّبُونِۚ ﴿١١٧﴾ فَافْتَحْ بَيْنِي وَبَيْنَهُمْ فَتْحًا وَنَجِّنِي وَمَنْ
مَعِيَ مِنَ الْمُؤْمِنِينَ ﴿١١٨﴾ فَاَنْجَيْنَاهُ وَمَنْ مَعَهُ فِي الْفُلْكِ الْمَشْحُونِۚ ﴿١١٩﴾ ثُمَّ اَغْرَقْنَا بَعْدُ
الْبَاقِينَۜ ﴿١٢٠﴾

---

**lər tabe olublar,** (onlar da ancaq zahirdə sənə iman gətiriblər, onları qovsan, bəlkə, sənə tabe olarıq. Nuha iman gətirənlər kasıb olduqlarından onları əskik və zəlil hesab edib onlarla bir yerdə olmağı özlərinə sığışdırmayıb təkəbbürləndilər)**.**

**112)** (قَالَ وَمَا عِلْمِي بِمَا كَانُوا يَعْمَلُونَ) – (Nuh) **dedi:** (mənə iman gətirənlərin batində) **etdiklərinə dair bir məlumatım yoxdur,** (mən ancaq zahirə baxaram, zahirdə onlar mənə iman gətiriblər)**.**

**113)** (اِنْ حِسَابُهُمْ اِلَّا عَلٰى رَبِّي لَوْ تَشْعُرُونَ) – **əgər siz** (onların batinini) **bilsəniz də, onların haqq-hesabları ancaq Allah-Təalayadır.** (Mən ancaq onların zahiri imanlarından məsulam)**.**

**114)** (وَمَٓا اَنَا بِطَارِدِ الْمُؤْمِنِينَ) - **mənə iman gətirənləri** (öz yanımdan) **qovan deyiləm.**

**115)** (اِنْ اَنَا اِلَّا نَذِيرٌ مُبِينٌ) - **mən ancaq** (Allah-Təala tərəfindən) **açıq-aşkar qorxudanam.**

**116)** (قَالُوا لَئِنْ لَمْ تَنْتَهِ يَا نُوحُ لَتَكُونَنَّ مِنَ الْمَرْجُومِينَ) - **dedilər: "**(ey Nuh)**, əgər** (bu dediklərindən) **vaz keçməsən, əlbəttə, daşqalaq ediləndərdən olacaqsan"** (yəni səni daşla vurub qətlə yetirəcəyik)**.**

**117)** (قَالَ رَبِّ اِنَّ قَوْمِي كَذَّبُونِ) – (Nuh Allah-Təalaya dua edib) **dedi: "Ey mənim rəbbim, həqiqətən, mənim qövmüm məni təkzib edib** (mənə itaət etmədi)**.**

**118)** (فَافْتَحْ بَيْنِي وَبَيْنَهُمْ فَتْحًا) - **Ey mənim rəbbim, mənimlə onların arasında bir hökm ver,** (وَنَجِّنِي وَمَنْ مَعِيَ مِنَ الْمُؤْمِنِينَ) **-məni və mənimlə olan möminləri** (bu zalımlardan) **xilas et."**

**119)** (فَاَنْجَيْنَاهُ وَمَنْ مَعَهُ فِي الْفُلْكِ الْمَشْحُونِ) – (Nuhu) **və onunla birlikdə dolu gəmidə olan** (möminləri və heyvanatı) **qurtardıq.**

**120)** (ثُمَّ اَغْرَقْنَا بَعْدُ الْبَاقِينَ) – (onlara nicat verəndən) **sonra yerdə qalan** (Nuh qövmünü) **qərq edib** (həlak etdik)**.**

اِنَّ فٖي ذٰلِكَ لَاٰيَةًۜ وَمَا كَانَ اَكْثَرُهُمْ مُؤْمِنٖينَ ﴿١٢١﴾ وَاِنَّ رَبَّكَ لَهُوَ الْعَزٖيزُ الرَّحٖيمُ۟ ﴿١٢٢﴾ كَذَّبَتْ
عَادٌ الْمُرْسَلٖينَۚ ﴿١٢٣﴾ اِذْ قَالَ لَهُمْ اَخُوهُمْ هُودٌ اَلَا تَتَّقُونَۚ ﴿١٢٤﴾ اِنّٖي لَكُمْ رَسُولٌ اَمٖينٌۙ ﴿١٢٥﴾
فَاتَّقُوا اللّٰهَ وَاَطٖيعُونِۚ ﴿١٢٦﴾ وَمَٓا اَسْـَٔلُكُمْ عَلَيْهِ مِنْ اَجْرٍۚ اِنْ اَجْرِيَ اِلَّا عَلٰى رَبِّ الْعَالَمٖينَۜ ﴿١٢٧﴾
اَتَبْنُونَ بِكُلِّ رٖيعٍ اٰيَةً تَعْبَثُونَۙ ﴿١٢٨﴾ وَتَتَّخِذُونَ مَصَانِعَ لَعَلَّكُمْ تَخْلُدُونَۚ ﴿١٢٩﴾ وَاِذَا بَطَشْتُمْ
بَطَشْتُمْ جَبَّارٖينَۚ ﴿١٣٠﴾

---

**121)** (اِنَّ فٖي ذٰلِكَ لَاٰيَةًۜ وَمَا كَانَ اَكْثَرُهُمْ مُؤْمِنٖينَ) - (ey Məhəmməd)**, həqiqətən, bu** (Nuhun əhvalatında Allah-Təalanın tövhid və qüdrətinə dair) **dəlil və sübutlar var, amma** (insanların) **əksəriyyəti** (bu dəlillərə baxıb Allah-Təalaya) **iman gətirən deyil.**

**122)** (وَاِنَّ رَبَّكَ لَهُوَ الْعَزٖيزُ الرَّحٖيمُ) - (ey Məhəmməd)**, həqiqətən, sənin rəbbin** (müşriklərə) **qalib olub** (intiqam alandır və tövbə edib saleh əməl edənləri) **rəhm edib** (bağışlayandır)**.**

**123)** (كَذَّبَتْ عَادٌ الْمُرْسَلٖينَ) **- Ad camaatı** (Hud peyğəmbəri və ondan əvvəl Allah-Təala tərəfindən göndərilən) **peyğəmbərləri təkzib etdilər.**

**124)** (اِذْ قَالَ لَهُمْ اَخُوهُمْ هُودٌ اَلَا تَتَّقُونَ) **– o zaman ki qardaşları Hud onlara dedi:** (Allah-Təaladan) **qorxub** (şirki və küfrü tərk etməzsinizmi?)

**125)** (اِنّٖي لَكُمْ رَسُولٌ اَمٖينٌ) **- həqiqətən, mən sizə** (Allah-Təala tərəfindən göndərilən) **əmin bir peyğəmbərəm.**

**126)** (فَاتَّقُوا اللّٰهَ وَاَطٖيعُونِ) **– Allah-Təaladan qorxub mənə itaət edin.**

**127)** (وَمَٓا اَسْـَٔلُكُمْ عَلَيْهِ مِنْ اَجْرٍ اِنْ اَجْرِيَ اِلَّا عَلٰى رَبِّ الْعَالَمٖينَ) – (mən sizə nəsihət edib Allah-Təalanın hökmlərini bildirdiyim üçün) **sizdən bir əcr və mükafat istəmirəm. Mənim əcrim ancaq Allah-Təalaya aiddir.**

**128)** (اَتَبْنُونَ بِكُلِّ رٖيعٍ اٰيَةً تَعْبَثُونَ) – (bəs Allah-Təaladan qorxmursunuz ki,) **hər bir uca* yerə bir əlamət tikib,** (gəlib-gedənlərə istehza edib) **əylənirsiniz?**

*(*Qeyd: Ad camaatı yol kənarında uca yerlərdə binalar tikib, Allah-Təalanın verdiyi nemətlərə aldanıb gəlib-gedənlərə əziyyət edib istehza edərdilər. Hud onlara bu əməli tərk etməyi əmr edir).*

**129)** (وَتَتَّخِذُونَ مَصَانِعَ لَعَلَّكُمْ تَخْلُدُونَ) **- özünüzdən ötrü** (möhkəm) **su anbarları** (və uca qəsrlər) **tikirsiniz ki, bəlkə** (onların səbəbinə dünyada) **əbədi qalasınız.**

**130)** (وَاِذَا بَطَشْتُمْ) – (məzlum bir şəxsə) **hücum etdikdə,** (بَطَشْتُمْ جَبَّارٖينَ) **- qeyz və qəzəblə hücum edirsiniz,** (bu insanlığa ziddir, qınanmışdır)**.**

فَاتَّقُوا اللّٰهَ وَاَطِيعُونِۚ ﴿١٣١﴾ وَاتَّقُوا الَّذٖٓي اَمَدَّكُمْ بِمَا تَعْلَمُونَۚ ﴿١٣٢﴾ اَمَدَّكُمْ بِاَنْعَامٍ وَبَنٖينَۙ
﴿١٣٣﴾ وَجَنَّاتٍ وَعُيُونٍۚ ﴿١٣٤﴾ اِنّٖٓي اَخَافُ عَلَيْكُمْ عَذَابَ يَوْمٍ عَظٖيمٍؕ ﴿١٣٥﴾ قَالُوا سَوَٓاءٌ عَلَيْنَٓا
اَوَعَظْتَ اَمْ لَمْ تَكُنْ مِنَ الْوَاعِظٖينَۙ ﴿١٣٦﴾ اِنْ هٰذَٓا اِلَّا خُلُقُ الْاَوَّلٖينَۙ ﴿١٣٧﴾ وَمَا نَحْنُ بِمُعَذَّبٖينَۚ
﴿١٣٨﴾ فَكَذَّبُوهُ فَاَهْلَكْنَاهُمْۜ اِنَّ فٖي ذٰلِكَ لَاٰيَةًۜ وَمَا كَانَ اَكْثَرُهُمْ مُؤْمِنٖينَ ﴿١٣٩﴾ وَاِنَّ رَبَّكَ لَهُوَ
الْعَزٖيزُ الرَّحٖيمُ۟ ﴿١٤٠﴾ كَذَّبَتْ ثَمُودُ الْمُرْسَلٖينَۚ ﴿١٤١﴾

---

**131)** (فَاتَّقُوا اللّٰهَ وَاَطِيعُونِ) **– Allah-Təaladan qorxub mənə itaət edin.**

**132)** (وَاتَّقُوا الَّذٖي اَمَدَّكُمْ بِمَا تَعْلَمُونَ) **- qorxun o Allah-Təaladan ki, bildiyiniz şeylərlə sizə yardım edib** (bol nemət verdi)**.**

**133)** (اَمَدَّكُمْ بِاَنْعَامٍ وَبَنٖينَ) – (Allah-Təala) **sizə heyvanlarla** (dəvə, öküz, qoyun, keçi) **və oğullarla** (nemət verib) **yardım etdi.**

**134)** (وَجَنَّاتٍ وَعُيُونٍ) **– bir də bağlar və** (dadlı) **çeşmələr** (verdi, amma siz bu nemətlərin hamısına nankor oldunuz)**.**

**135)** (اِنّٖي اَخَافُ عَلَيْكُمْ عَذَابَ يَوْمٍ عَظٖيمٍ) **- həqiqətən, mən sizin üçün böyük bir günün** (qiyamət günü) **əzabından qorxuram.**

**136)** (قَالُوا سَوَٓاءٌ عَلَيْنَٓا اَوَعَظْتَ اَمْ لَمْ تَكُنْ مِنَ الْوَاعِظٖينَ) **-** (Hudun qövmü onun cavabında) **dedilər: "**(ey Hud)**, sən bizə nəsihət etsən də, nəsihət edən olmasan da, bizim üçün eynidir.** (Biz sənə iman gətirmərik)**.**

**137)** (اِنْ هٰذَٓا اِلَّا خُلُقُ الْاَوَّلٖينَ) **- bu** (din) **əvvəlki** (ümmətlərin) **adətindən başqa bir şey deyil,** (dünyaya gəlib yaşadılar, sonra da ölüb getdilər, nə qiyamət var, nə haqq-hesab, biz də onların adətinə tabe olub gedirik)**.**

**138)** (وَمَا نَحْنُ بِمُعَذَّبٖينَ) **- biz əzab olunan deyilik."** (Yəni qiyamət, cəza günü yoxdur ki, bizə əzab olunsun)**.**

**139)** (فَكَذَّبُوهُ فَاَهْلَكْنَاهُمْ) **–** (Hudu) **təkzib etdilər, biz də onları həlak etdik.** (اِنَّ فٖي ذٰلِكَ لَاٰيَةً وَمَا كَانَ اَكْثَرُهُمْ مُؤْمِنٖينَ) **-** (ey Məhəmməd)**, həqiqətən, bu** (Hudun əhvalatında Allah-Təalanın tövhid və qüdrətinə dair) **dəlil və sübutlar var. Amma** (insanların) **əksəriyyəti** (dəlil, sübuta baxıb Allah-Təalaya) **iman gətirən deyil.**

**140)** (وَاِنَّ رَبَّكَ لَهُوَ الْعَزٖيزُ الرَّحٖيمُ) **-** (ey Məhəmməd)**, həqiqətən, sənin rəbbin** (müşriklərə) **qalib** (olub onlardan intiqam alandır və tövbə edib saleh əməl edənləri) **rəhm edib** (bağışlayandır)**.**

**141)** (كَذَّبَتْ ثَمُودُ الْمُرْسَلٖينَ) **- Səmud** (camaatı Saleh peyğəmbəri və ondan əvvəl göndərilən) **peyğəmbərləri təkzib etdi.**

اِذْ قَالَ لَهُمْ اَخُوهُمْ صَالِحٌ اَلَا تَتَّقُونَۚ ﴿١٤٢﴾ اِنّ۪ي لَكُمْ رَسُولٌ اَم۪ينٌۙ ﴿١٤٣﴾ فَاتَّقُوا اللّٰهَ وَاَط۪يعُونِۚ
﴿١٤٤﴾ وَمَٓا اَسْـَٔلُكُمْ عَلَيْهِ مِنْ اَجْرٍۚ اِنْ اَجْرِيَ اِلَّا عَلٰى رَبِّ الْعَالَم۪ينَۜ ﴿١٤٥﴾ اَتُتْرَكُونَ ف۪ي مَا هٰهُنَٓا
اٰمِن۪ينَۙ ﴿١٤٦﴾ ف۪ي جَنَّاتٍ وَعُيُونٍۙ ﴿١٤٧﴾ وَزُرُوعٍ وَنَخْلٍ طَلْعُهَا هَض۪يمٌۚ ﴿١٤٨﴾ وَتَنْحِتُونَ مِنَ
الْجِبَالِ بُيُوتًا فَارِه۪ينَۚ ﴿١٤٩﴾ فَاتَّقُوا اللّٰهَ وَاَط۪يعُونِۚ ﴿١٥٠﴾ وَلَا تُط۪يعُٓوا اَمْرَ الْمُسْرِف۪ينَۙ ﴿١٥١﴾
اَلَّذ۪ينَ يُفْسِدُونَ فِي الْاَرْضِ وَلَا يُصْلِحُونَ ﴿١٥٢﴾ قَالُٓوا اِنَّمَٓا اَنْتَ مِنَ الْمُسَحَّر۪ينَۚ ﴿١٥٣﴾

---

**142)** (اِذْ قَالَ لَهُمْ اَخُوهُمْ صَالِحٌ اَلَا تَتَّقُونَ) – **o zaman qardaşları Saleh onlara dedi: "Bəs** (Allah-Təaladan) **qorxub** (şirki və küfrü tərk etməzsinizmi?)"

**143)** (اِنّ۪ي لَكُمْ رَسُولٌ اَم۪ينٌ) - **həqiqətən, mən sizə** (Allah-Təala tərəfindən gələn) **əmin bir peyğəmbərəm.**

**144)** (فَاتَّقُوا اللّٰهَ وَاَط۪يعُونِ) - **Allah-Təaladan qorxub mənə itaət edin.**

**145)** (وَمَٓا اَسْـَٔلُكُمْ عَلَيْهِ مِنْ اَجْرٍ اِنْ اَجْرِيَ اِلَّا عَلٰى رَبِّ الْعَالَم۪ينَ) – (sizə nəsihət edib Allah-Təalanın hökmlərini bildirdiyim üçün) **sizdən heç bir əcr və mükafat istəmirəm, mənim əcr, mükafatım ancaq Allah-Təalaya aiddir.** (Öz lütf və kəramətindən mənə əcr və mükafat bəxş edəcəkdir)**.**

**146)** (اَتُتْرَكُونَ ف۪ي مَا هٰهُنَٓا اٰمِن۪ينَ) – (bu nemətlər ki, bu məkanda var)**, siz** (bu nemətlərin içində hər bir əzabdan) **arxayın buraxılacaqsınız?** (Elə deyil. Allah-Təalanın nemətlərinə şükür etməsəniz, Allah-Təala əzab göndərib sizi həlak edəcəkdir)**.**

**147)** (ف۪ي جَنَّاتٍ وَعُيُونٍ) – (Saleh onlara verilən nemətləri bəyan edir: yaxşı) **bağlar və** (dadlı) **çeşmələr içindəsiniz.**

**148)** (وَزُرُوعٍ وَنَخْلٍ طَلْعُهَا هَض۪يمٌ) - **əkinlər və lətif meyvəli xurma ağacları** (içindəsiniz)**,**

**149)** (وَتَنْحِتُونَ مِنَ الْجِبَالِ بُيُوتًا فَارِه۪ينَ) - **dağlardan** (özünüzə məharətlə) **evlər yonub, şad olursunuz.**

**150)** (فَاتَّقُوا اللّٰهَ وَاَط۪يعُونِ) – **Allah-Təaladan qorxub mənə itaət edin.**

**151)** (وَلَا تُط۪يعُٓوا اَمْرَ الْمُسْرِف۪ينَ) – (Allah-Təalanın itaətindən çıxıb, günahda) **həddi aşanların əmrinə itaət etməyin.**

**152)** (اَلَّذ۪ينَ يُفْسِدُونَ فِي الْاَرْضِ وَلَا يُصْلِحُونَ) – (həddi aşanlar) **o şəxslərdir ki, yer üzündə həmişə fəsad törədib, heç bir xeyir iş də etməzlər.**

**153)** (قَالُٓوا اِنَّمَٓا اَنْتَ مِنَ الْمُسَحَّر۪ينَ) - (Salehin qövmü ona cavab verib) **dedilər: "Həqiqətən,** (ey Saleh)**, sən sehrlənmişlərdənsən,** (bu səbəbdən ağlını itiribsən)**.**

مَٓا اَنْتَ اِلَّا بَشَرٌ مِثْلُنَاۚ فَأْتِ بِاٰيَةٍ اِنْ كُنْتَ مِنَ الصَّادِقِينَ ﴿١٥٤﴾ قَالَ هٰذِهٖ نَاقَةٌ لَهَا شِرْبٌ وَلَكُمْ شِرْبُ يَوْمٍ مَعْلُومٍۚ ﴿١٥٥﴾ وَلَا تَمَسُّوهَا بِسُٓوءٍ فَيَأْخُذَكُمْ عَذَابُ يَوْمٍ عَظِيمٍ ﴿١٥٦﴾ فَعَقَرُوهَا فَاَصْبَحُوا نَادِمِينَۙ ﴿١٥٧﴾ فَاَخَذَهُمُ الْعَذَابُۜ اِنَّ فِي ذٰلِكَ لَاٰيَةًۜ وَمَا كَانَ اَكْثَرُهُمْ مُؤْمِنِينَ ﴿١٥٨﴾ وَاِنَّ رَبَّكَ لَهُوَ الْعَزِيزُ الرَّحِيمُ۟ ﴿١٥٩﴾ كَذَّبَتْ قَوْمُ لُوطٍ الْمُرْسَلِينَۚ ﴿١٦٠﴾ اِذْ قَالَ لَهُمْ اَخُوهُمْ لُوطٌ اَلَا تَتَّقُونَۚ ﴿١٦١﴾

---

**154)** (مَٓا اَنْتَ اِلَّا بَشَرٌ مِثْلُنَا) **- sən ancaq bizim kimi bir insansan,** (necə olur ki, insandan peyğəmbər olsun?) (فَأْتِ بِاٰيَةٍ اِنْ كُنْتَ مِنَ الصَّادِقِينَ) **- əgər** (bu iddianda) **doğru deyənlərdənsənsə,** (bizə) **bir möcüzə gətir** (ki, doğruluğun aşkar olsun)**.”**

**155)** (قَالَ هٰذِهٖ نَاقَةٌ لَهَا شِرْبٌ وَلَكُمْ شِرْبُ يَوْمٍ مَعْلُومٍ)– (Saleh) **dedi: “Bu** (Allah-Təalanın sizin üçün daşdan çıxartdığı möcüzə) **bir dəvədir,** (amma bu şərtlə ki,) **su içilməsi** (bir gün) **dəvənin, bir gün sizin haqqınızdır.** (Dəvə su içən günlərdə də su əvəzinə sizə süd verər)**.**

**156)** (وَلَا تَمَسُّوهَا بِسُٓوءٍ فَيَأْخُذَكُمْ عَذَابُ يَوْمٍ عَظِيمٍ) – (amma dəvə su içdiyi üçün qəzəblənib) **ona pislik edib vurmayın, yoxsa böyük bir günün əzabı sizi yaxalayar,** (həlak olarsınız. Dəvəni öldürəndən sonra o əzaba düçar oldular)**.**

**157)** (فَعَقَرُوهَا فَاَصْبَحُوا نَادِمِينَ) – (Salehin sözünə baxmayıb o dəvənin arxa ayağının damarını) **kəsib** (onu öldürdülər)**, sonra da** (əzab qorxusu ilə) **peşman oldular.** (Amma tövbə edərək peşman olsaydılar, Allah-Təala onların tövbəsini qəbul edib bağışlayardı. Dəvəni qətlə yetirən Qudarə ibn Salif adlı bir şəxs idi. Camaata dedi: “Dəvəni hamınız razı oluncaya qədər qətlə yetirmərəm”, birbəbir hamısından razılıq aldı, hətta arvadlardan və uşaqlardan da, ondan sonra gedib dəvəni öldürdü)**.**

**158)** (فَاَخَذَهُمُ الْعَذَابُ) – (Allah-Təalanın) **əzabı** (səmadan od gəlib) **hamısını yaxalayıb** (həlak etdi)**.** (اِنَّ فِي ذٰلِكَ لَاٰيَةً وَمَا كَانَ اَكْثَرُهُمْ مُؤْمِنِينَ) - (ey Məhəmməd)**, həqiqətən, bu** (Salehin əhvalatında Allah-Təalanın tövhid və qüdrətinə dair) **dəlil və sübutlar var. Amma** (insanların) **əksəriyyəti** (dəlilə baxıb Allah-Təalaya) **iman gətirən deyil.**

**159)** (وَاِنَّ رَبَّكَ لَهُوَ الْعَزِيزُ الرَّحِيمُ) - (ey Məhəmməd)**, həqiqətən, sənin rəbbin** (müşriklərə) **qalib** (olub intiqam alandır və tövbə edib saleh əməl edən şəxsləri) **rəhm edib** (bağışlayandır)**.**

**160)** (كَذَّبَتْ قَوْمُ لُوطٍ الْمُرْسَلِينَ) **- Lut** (peyğəmbərin) **qövmü** (Lutu və ondan əvvəlki) **peyğəmbərləri təkzib etdilər.**

**161)** (اِذْ قَالَ لَهُمْ اَخُوهُمْ لُوطٌ اَلَا تَتَّقُونَ) **– o zaman qardaşları Lut onlara demişdi: “**(Allah-Təaladan) **qorxub** (şirki və küfrü tərk etməzsinizmi?)

اِنّي لَكُمْ رَسُولٌ اَمينٌۙ ﴿١٦٢﴾ فَاتَّقُوا اللّٰهَ وَاَطيعُونِۚ ﴿١٦٣﴾ وَمَٓا اَسْـَٔلُكُمْ عَلَيْهِ مِنْ اَجْرٍۚ اِنْ اَجْرِيَ
اِلَّا عَلٰى رَبِّ الْعَالَمينَۜ ﴿١٦٤﴾ اَتَأْتُونَ الذُّكْرَانَ مِنَ الْعَالَمينَۙ ﴿١٦٥﴾ وَتَذَرُونَ مَا خَلَقَ لَكُمْ
رَبُّكُمْ مِنْ اَزْوَاجِكُمْۜ بَلْ اَنْتُمْ قَوْمٌ عَادُونَ ﴿١٦٦﴾ قَالُوا لَئِنْ لَمْ تَنْتَهِ يَا لُوطُ لَتَكُونَنَّ مِنَ الْمُخْرَجينَ
﴿١٦٧﴾ قَالَ اِنّي لِعَمَلِكُمْ مِنَ الْقَالينَۜ ﴿١٦٨﴾ رَبِّ نَجِّني وَاَهْلي مِمَّا يَعْمَلُونَ ﴿١٦٩﴾ فَنَجَّيْنَاهُ
وَاَهْلَهُٓ اَجْمَعينَۙ ﴿١٧٠﴾ اِلَّا عَجُوزًا فِي الْغَابِرينَۚ ﴿١٧١﴾ ثُمَّ دَمَّرْنَا الْاٰخَرينَۚ ﴿١٧٢﴾

---

**162)** (اِنّي لَكُمْ رَسُولٌ اَمينٌ) **- həqiqətən, mən sizə** (Allah-Təala tərəfindən göndərilən) **əmin bir peyğəmbərəm.**

**163)** (فَاتَّقُوا اللّٰهَ وَاَطيعُونِ) **- Allah-Təaladan qorxub mənə itaət edin.**

**164)** (وَمَٓا اَسْـَٔلُكُمْ عَلَيْهِ مِنْ اَجْرٍ اِنْ اَجْرِيَ اِلَّا عَلٰى رَبِّ الْعَالَمينَ) – (sizə nəsihət edib Allah-Təalanın hökmlərini çatdırdığım üçün) **sizdən əcr və mükafat istəmirəm. Mənim əcr, mükafatım ancaq Allah-Təalaya aiddir.**

**165)** (اَتَأْتُونَ الذُّكْرَانَ مِنَ الْعَالَمينَ) – **insanların arasında** (qadınları qoyub) **kişilərlə yaxınlıq edirsiniz?**

**166)** (وَتَذَرُونَ مَا خَلَقَ لَكُمْ رَبُّكُمْ مِنْ اَزْوَاجِكُمْ) **- Allah-Təalanın sizin üçün yaratdığı arvadlarınızı tərk edib** (gedib kişilərlə belə qəbih əməl edirsiniz?) (بَلْ اَنْتُمْ قَوْمٌ عَادُونَ) – **siz** (Allah-Təalanın qoyduğu) **həddi aşıb** (zalım olan bir camaatsınız)**.”**

**167)** (قَالُوا لَئِنْ لَمْ تَنْتَهِ يَا لُوطُ لَتَكُونَنَّ مِنَ الْمُخْرَجينَ) **-** (Lutun qövmü cavab verib) **dedilər: “Ey Lut, əgər** (bu sözlərinə) **son qoymasan, əlbəttə,** (bizim aramızdan) **çıxanlardan olacaqsan.** (Səni zorla öz aramızdan qovarıq)**.”**

**168)** (قَالَ اِنّي لِعَمَلِكُمْ مِنَ الْقَالينَ) – (Lut) **dedi: “Həqiqətən, mən sizin bu əməllərinizə nifrət edib xoşlamıram.”** (Ondan sonra dua etməyə başladı)

**169)** (رَبِّ نَجِّني وَاَهْلي مِمَّا يَعْمَلُونَ) **- “Ey mənim rəbbim, mənim özümü və ailəmi** (bu kafirlərin) **etdiyi** (əməlin əzabından) **xilas et.”**

**170)** (فَنَجَّيْنَاهُ وَاَهْلَهُٓ اَجْمَعينَ) **-** (ey Məhəmməd, Lutun özünü və ailəsinin hamısını əzabdan) **xilas etdik.**

**171)** (اِلَّا عَجُوزًا فِي الْغَابِرينَ) **- ancaq** (Lutun) **arvadı istisnadır, geridə qalanlardan olub** (onu da əzab yaxalayıb həlak oldu)**.**

**172)** (ثُمَّ دَمَّرْنَا الْاٰخَرينَ) – (onlara nicat verəndən) **sonra qalanlarını həlak etdik.**

وَاَمْطَرْنَا عَلَيْهِمْ مَطَرًاۚ فَسَٓاءَ مَطَرُ الْمُنْذَرِينَ ﴿١٧٣﴾ اِنَّ فِي ذٰلِكَ لَاٰيَةًۜ وَمَا كَانَ اَكْثَرُهُمْ مُؤْمِنِينَ ﴿١٧٤﴾
وَاِنَّ رَبَّكَ لَهُوَ الْعَزِيزُ الرَّحِيمُ ﴿١٧٥﴾ كَذَّبَ اَصْحَابُ الْاَيْكَةِ الْمُرْسَلِينَۚ ﴿١٧٦﴾ اِذْ قَالَ لَهُمْ شُعَيْبٌ
اَلَا تَتَّقُونَۚ ﴿١٧٧﴾ اِنِّي لَكُمْ رَسُولٌ اَمِينٌۙ ﴿١٧٨﴾ فَاتَّقُوا اللّٰهَ وَاَطِيعُونِۚ ﴿١٧٩﴾ وَمَٓا اَسْـَٔلُكُمْ عَلَيْهِ مِنْ
اَجْرٍۚ اِنْ اَجْرِيَ اِلَّا عَلٰى رَبِّ الْعَالَمِينَۜ ﴿١٨٠﴾ اَوْفُوا الْكَيْلَ وَلَا تَكُونُوا مِنَ الْمُخْسِرِينَۚ ﴿١٨١﴾ وَزِنُوا
بِالْقِسْطَاسِ الْمُسْتَقِيمِۚ ﴿١٨٢﴾ وَلَا تَبْخَسُوا النَّاسَ اَشْيَٓاءَهُمْ وَلَا تَعْثَوْا فِي الْاَرْضِ مُفْسِدِينَۚ ﴿١٨٣﴾

---

**173)** (وَاَمْطَرْنَا عَلَيْهِمْ مَطَرًا) – (Lut qövmünə əzab) **yağışı göndərdik.** (فَسَٓاءَ مَطَرُ الْمُنْذَرِينَ) – (Lut tərəfindən) **qorxudulanların yağışı nə pis yağışdır,** (yağış insan üçün rəhmətdir, amma Lut qövmündən ötrü əzab oldu)**.**

**174)** (اِنَّ فِي ذٰلِكَ لَاٰيَةً وَمَا كَانَ اَكْثَرُهُمْ مُؤْمِنِينَ) - (ey Məhəmməd)**, həqiqətən, bu** (Lutun əhvalatında Allah-Təalanın tövhid və qüdrətinə dair) **dəlil və sübutlar var. Amma** (insanların) **əksəriyyəti** (dəlilə baxıb Allah-Təalaya) **iman gətirən deyil.**

**175)** (وَاِنَّ رَبَّكَ لَهُوَ الْعَزِيزُ الرَّحِيمُ) - (ey Məhəmməd)**, həqiqətən, sənin rəbbin** (müşriklərə) **qalib** (olub intiqam alandır və tövbə edib saleh əməl edənləri) **rəhm edib** (bağışlayandır)**.**

**176)** (كَذَّبَ اَصْحَابُ الْاَيْكَةِ الْمُرْسَلِينَ) - **Eykə camaatı** (Şüeyb peyğəmbəri və ondan əvvəlki) **peyğəmbərləri təkzib etdilər.**

**177)** (اِذْ قَالَ لَهُمْ شُعَيْبٌ اَلَا تَتَّقُونَ) – **o zaman Şüeyb onlara demişdi:** (Allah-Təaladan) **qorxub** (şirki və küfrü tərk etməzsiniz? Şüeyb Eykə camaatından olmadığından Allah-Təala ona qardaş demədi)**.**

**178)** (اِنِّي لَكُمْ رَسُولٌ اَمِينٌ) - **həqiqətən, mən sizə** (Allah-Təala tərəfindən göndərilən) **əmin bir peyğəmbərəm.**

**179)** (فَاتَّقُوا اللّٰهَ وَاَطِيعُونِ) - **Allah-Təaladan qorxub mənə itaət edin.**

**180)** (وَمَٓا اَسْـَٔلُكُمْ عَلَيْهِ مِنْ اَجْرٍ اِنْ اَجْرِيَ اِلَّا عَلٰى رَبِّ الْعَالَمِينَ) – (sizə nəsihət edib Allah-Təalanın hökmlərini çatdırdığım üçün) **sizdən bir əcr və mükafat istəmirəm. Mənim əcr və mükafatım Allah-Təalaya aiddir.**

**181)** (اَوْفُوا الْكَيْلَ وَلَا تَكُونُوا مِنَ الْمُخْسِرِينَ) - (Eykə camaatı alış-verişdə, ölçü və çəkidə xəyanətkar olduqlarından Şüeyb bunu tərk etməyi onlara əmr edib deyir:) **ölçüdə düz olun,** (camaatın haqqını) **azaldanlardan olmayın.**

**182)** (وَزِنُوا بِالْقِسْطَاسِ الْمُسْتَقِيمِ) - **tərəzi ilə düz çəkin.**

**183)** (وَلَا تَبْخَسُوا النَّاسَ اَشْيَٓاءَهُمْ) – (artıq-əskik alıb-satmaqla) **insanların malını azaltmayın.** (وَلَا تَعْثَوْا فِي الْاَرْضِ مُفْسِدِينَ) - **yer üzündə** (yol kəsmək, qəsb etmək, qətl kimi) **fitnə-fəsad törətməyin.**

وَاتَّقُوا الَّذِي خَلَقَكُمْ وَالْجِبِلَّةَ الْاَوَّلِينَ ﴿١٨٤﴾ قَالُوٓا اِنَّمَآ اَنْتَ مِنَ الْمُسَحَّرِينَ ﴿١٨٥﴾ وَمَآ اَنْتَ
اِلَّا بَشَرٌ مِثْلُنَا وَاِنْ نَظُنُّكَ لَمِنَ الْكَاذِبِينَ ﴿١٨٦﴾ فَاَسْقِطْ عَلَيْنَا كِسَفًا مِنَ السَّمَآءِ اِنْ كُنْتَ مِنَ
الصَّادِقِينَ ﴿١٨٧﴾ قَالَ رَبِّيٓ اَعْلَمُ بِمَا تَعْمَلُونَ ﴿١٨٨﴾ فَكَذَّبُوهُ فَاَخَذَهُمْ عَذَابُ يَوْمِ الظُّلَّةِ اِنَّهُ
كَانَ عَذَابَ يَوْمٍ عَظِيمٍ ﴿١٨٩﴾ اِنَّ فِي ذٰلِكَ لَاٰيَةً وَمَا كَانَ اَكْثَرُهُمْ مُؤْمِنِينَ ﴿١٩٠﴾ وَاِنَّ رَبَّكَ لَهُوَ
الْعَزِيزُ الرَّحِيمُ ﴿١٩١﴾

---

**184)** (وَاتَّقُوا الَّذِي خَلَقَكُمْ وَالْجِبِلَّةَ الْاَوَّلِينَ) **- qorxun** (o Allah-Təaladan ki,) **sizi və sizdən əvvəlkiləri yaradıbdır.**

**185)** (قَالُوا اِنَّمَا اَنْتَ مِنَ الْمُسَحَّرِينَ) **- dedilər: “**(ey Şüeyb)**, həqiqətən, sən sehrlənmiş şəxslərdənsən.**

**186)** (وَمَا اَنْتَ اِلَّا بَشَرٌ مِثْلُنَا) **- sən ancaq bizim kimi bir insansan,** (necə olur ki, insandan peyğəmbər olsun?) (وَاِنْ نَظُنُّكَ لَمِنَ الْكَاذِبِينَ) **- həqiqətən, biz sənin yalançılardan olduğunu güman edirik.**

**187)** (فَاَسْقِطْ عَلَيْنَا كِسَفًا مِنَ السَّمَاءِ اِنْ كُنْتَ مِنَ الصَّادِقِينَ)**- əgər** (peyğəmbərlik iddianda) **doğru danışanlardansansa, səmadan üstümüzə bir parça sal.** (O vaxt sənin doğru olduğun məlum olar)**.**

**188)** (قَالَ رَبِّي اَعْلَمُ بِمَا تَعْمَلُونَ) **–** (Şüeyb) **dedi: “Mənim rəbbim Allah-Təala etdiyiniz əməllərə agahdır** (və onların cəzasını verəcəkdir)**.”**

**189)** (فَكَذَّبُوهُ فَاَخَذَهُمْ عَذَابُ يَوْمِ الظُّلَّةِ) **-** (Eykə camaatı Şüeybi) **təkzib etdilər, kölgəli günün əzabı onları yaxaladı,** (اِنَّهُ كَانَ عَذَابَ يَوْمٍ عَظِيمٍ)**- həqiqətən, o günün əzabı böyük əzabdı,** (o əzabdan heç kim xilas olmayıb hamısı həlak oldu. Eykə camaatı 7 gün küləksiz qalıb, havanın hərarətindən nəfəsləri tutuldu, yerin altında olan mağaralara daxil oldular, oranın hərarəti daha çox idi. Məcbur çölə çıxdılar. Bir bulud gördülər, o buludun kölgəsinə yığıldılar, o buluddan yağış əvəzinə od yağıb onların hamısını yandırıb həlak etdi)**.**

**190)** (اِنَّ فِي ذٰلِكَ لَاٰيَةً وَمَا كَانَ اَكْثَرُهُمْ مُؤْمِنِينَ) **-** (ey Məhəmməd)**, həqiqətən, bu** (Şüeybin əhvalatında Allah-Təalanın tövhid və qüdrətinə dair) **dəlil və sübutlar var. Amma** (insanların) **əksəriyyəti** (dəlilə tabe olub Allah-Təalaya) **iman gətirən deyil.**

**191)** (وَاِنَّ رَبَّكَ لَهُوَ الْعَزِيزُ الرَّحِيمُ) **-** (ey Məhəmməd)**, həqiqətən, sənin rəbbin** (müşriklərə) **qalib** (olub intiqam alandır və tövbə edib saleh əməl edən şəxsləri) **rəhm edib** (bağışlayandır. Bu mübarək surədə zikr olunan 8 peyğəmbərin qissəsi tamam oldu)**.**

وَاِنَّهُ لَتَنْزِيلُ رَبِّ الْعَالَمِينَ ﴿١٩٢﴾ نَزَلَ بِهِ الرُّوحُ الْاَمِينُ ﴿١٩٣﴾ عَلٰى قَلْبِكَ لِتَكُونَ مِنَ الْمُنْذِرِينَ
﴿١٩٤﴾ بِلِسَانٍ عَرَبِيٍّ مُبِينٍ ﴿١٩٥﴾ وَاِنَّهُ لَفِي زُبُرِ الْاَوَّلِينَ ﴿١٩٦﴾ اَوَلَمْ يَكُنْ لَهُمْ اٰيَةً اَنْ يَعْلَمَهُ
عُلَمٰٓؤُا بَنٖٓي اِسْرَآءِيلَ ﴿١٩٧﴾ وَلَوْ نَزَّلْنَاهُ عَلٰى بَعْضِ الْاَعْجَمِينَ ﴿١٩٨﴾ فَقَرَاَهُ عَلَيْهِمْ مَا كَانُوا بِهٖ
مُؤْمِنِينَ ﴿١٩٩﴾

---

**192)** (وَاِنَّهُ لَتَنْزِيلُ رَبِّ الْعَالَمِينَ) **-** (ey Məhəmməd)**, həqiqətən,** (bu Quran və onda zikr olunan ehkam, moizə və qissələrin hamısı) **aləmlərə tərbiyə verən** (yeganə) **Allah-Təala tərəfindən nazil olubdur.**

**193-194)** (نَزَلَ بِهِ الرُّوحُ الْاَمِينُ عَلٰى قَلْبِكَ لِتَكُونَ مِنَ الْمُنْذِرِينَ)– (bu Quranı) **Ruhül-əmin** (Cəbrayıl) **sənin qəlbinə nazil etdi ki,** (bu Quran səbəbinə insanları Allah-Təalanın əzabı ilə) **qorxudan peyğəmbərlərdən olasan.**

**195)** (بِلِسَانٍ عَرَبِيٍّ مُبِينٍ) – (bu Quranı sənin qəlbinə) **aşkar olan fəsih ərəb dilində nazil etdi.** (Hər peyğəmbər gərək özünə və qövmünə məxsus olan dillə göndərilib kitab gətirsin. Əgər öz dilindən başqa bir başqa dillə kitab gətirsə, o dili nə qədər yaxşı bilsə də, onun iddiası batil və o kitab etibarsız sayılar)**.**

**196)** (وَاِنَّهُ لَفِي زُبُرِ الْاَوَّلِينَ) – (bu Quran adətdən kənar bir kitab deyil ki, ondan üz döndərsinlər. Həqiqətən, onun uca məzmunu və dərin mənası) **əvvəlki** (peyğəmbərlərin) **kitablarında mövcuddur.** (Fərqi ancaq dilindədir. O peyğəmbərlərin kitabları ya süryani, ya da farsca olubdur, bu Quran isə ərəb dilindədir, amma hamısının sözləri Allah-Təalanın tövhidinə işarə edib, şirki qadağan edir. Məkkə əhli Mədinə yəhudilərinin üləmalarının yanına gedib Hz. Peyğəmbərin xüsusiyyətini onlardan soruşdular, onların üləmalarından Abdullah ibn Səlam, Bünyamin, Saləbə, Əsəd və Üseyd Hz. Peyğəmbərin haqq olduğuna şəhadət etdilər, Məkkə əhli onların şəhadətini qəbul etməyib rədd etdilər. Allah-Təala sıradakı ayədə müşriklərə bu mətləbi xəbər verir)**.**

**197)** (اَوَلَمْ يَكُنْ لَهُمْ اٰيَةً اَنْ يَعْلَمَهُ عُلَمٰٓؤُا بَنٖٓي اِسْرَآءِيلَ) **– məgər bəni-İsrail üləmasının** (hz Məhəmmədin haqlı olduğunu) **bilib** (şəhadət etmələri bu Qüreyş camaatından ötrü) **bir dəlil və sübut deyil?** (Əksinə, Hz. Məhəmmədin haqlılığı onlara məlumdur. Lakin küfr və inadlarından inkar edib Allah-Təalanın çırağını söndürmək istəyirlər. Amma Allah-Təala onların öz çırağını söndürüb, özlərini əzaba düçar edəcəkdir)**.**

**198-199)** (وَلَوْ نَزَّلْنَاهُ عَلٰى بَعْضِ الْاَعْجَمِينَ فَقَرَاَهُ عَلَيْهِمْ مَا كَانُوا بِهٖ مُؤْمِنِينَ) **- əgər** (bu Quranı ərəb dilində fəsih olmayan) **bir əcəmə nazil etsəydik,** (o şəxs bu Quranı Məkkə əhlinə və ya digər ərəblərə oxusaydı)**, ona iman gətirməyib** (deyərdilər: "Bu ərəb lisanında fəsih deyil, biz bunun sözünü qəbul etmərik.

كَذٰلِكَ سَلَكْنَاهُ فٖي قُلُوبِ الْمُجْرِمٖينَ ﴿٢٠٠﴾ لَا يُؤْمِنُونَ بِهٖ حَتّٰى يَرَوُا الْعَذَابَ الْاَلٖيمَ ﴿٢٠١﴾
فَيَأْتِيَهُمْ بَغْتَةً وَهُمْ لَا يَشْعُرُونَ ﴿٢٠٢﴾ فَيَقُولُوا هَلْ نَحْنُ مُنْظَرُونَ ﴿٢٠٣﴾ اَفَبِعَذَابِنَا يَسْتَعْجِلُونَ
﴿٢٠٤﴾ اَفَرَاَيْتَ اِنْ مَتَّعْنَاهُمْ سِنٖينَ ﴿٢٠٥﴾ ثُمَّ جَٓاءَهُمْ مَا كَانُوا يُوعَدُونَ ﴿٢٠٦﴾ مَٓا اَغْنٰى عَنْهُمْ
مَا كَانُوا يُمَتَّعُونَ ﴿٢٠٧﴾ وَمَٓا اَهْلَكْنَا مِنْ قَرْيَةٍ اِلَّا لَهَا مُنْذِرُونَ ﴿٢٠٨﴾ ذِكْرٰى

---

İndi ki bu Quranı Məhəmmədə fəsih ərəb dilində nazil etmişik, niyə qəbul etməyib iman gətirmirlər?)

**200)** (كَذٰلِكَ سَلَكْنَاهُ فٖي قُلُوبِ الْمُجْرِمٖينَ) – (Quranı təkzib edib şirk içində qaldıqları üçün küfr və inadkarlığı) **müşriklərin qəlbinə daxil etdik,** (küfr və inad onların qəlbindən çıxmayıb, o halda da ölüb əzaba düçar olacaqlar)**.**

**201)** (لَا يُؤْمِنُونَ بِهٖ حَتّٰى يَرَوُا الْعَذَابَ الْاَلٖيمَ) – (Allah-Təalaya asi olan müşriklər qiyamət günündə) **şiddətli əzabı görüncəyə qədər** (Qurana) **iman gətirməzlər,**

**202)** (فَيَأْتِيَهُمْ بَغْتَةً وَهُمْ لَا يَشْعُرُونَ) – (əzab) **qəfildən onları yaxalayar,** (vaxtından da) **agah olmazlar.**

**203)** (فَيَقُولُوا هَلْ نَحْنُ مُنْظَرُونَ) – (qiyamət günü əzabı görəndə müşriklər) **deyərlər: "Görəsən,** (dünyaya qayıdıb iman etməyimiz üçün) **bizə möhlət veriləcəkmi?"**

**204)** (اَفَبِعَذَابِنَا يَسْتَعْجِلُونَ) – (qiyamət günü onların cavabında deyilər: bu müşriklər həmin şəxslər deyil ki, dünyada) **bizim əzabımızın tez gəlməsini istəyib** (Hz. Məhəmmədə - əgər doğru deyirsənsə, vəd etdiyin o əzabı bizə tez gətir, deyirdilər. İndi ki o əzabı görürlər, niyə xilas olmaq üçün möhlət istəyirlər? Heç vaxt onlara möhlət verilməyib, həmişə əzab içində olacaqlar)**.**

**205)** (اَفَرَاَيْتَ اِنْ مَتَّعْنَاهُمْ سِنٖينَ) - (ey Məhəmməd)**, görürsən? Əgər** (dünyada bu müşriklərə) **illərcə** (uzun ömür və) **nemət versək,**

**206)** (ثُمَّ جَٓاءَهُمْ مَا كَانُوا يُوعَدُونَ) **- ondan sonra** (ölüb)**, onlara vəd edilən** (əzab) **gəlsə,** (bu dünyada aldıqları ləzzət bu əzabı onlardan dəf edərmi?)

**207)** (مَٓا اَغْنٰى عَنْهُمْ مَا كَانُوا يُمَتَّعُونَ) – (yox)**, onlara verilən nemətlər** (Allah-Təalanın əzabını) **onlardan dəf etməz,** (əlbəttə, onlara əzab olunacaqdır)**.**

**208)** (وَمَٓا اَهْلَكْنَا مِنْ قَرْيَةٍ اِلَّا لَهَا مُنْذِرُونَ) **-** (ey Məhəmməd)**, biz heç bir məmləkətin** (əhlini) (onları bizim əzabımızdan qorxudan) **bir peyğəmbər göndərmədən həlak etmədik,** (ancaq iman gətirmədikdən sonra əzab göndərib həlak etdik)**.**

**209)** (ذِكْرٰى) **– bu,** (ibrət almaları üçün) **öyüd-nəsihətdir,** (insanlara bəxş etdiyimiz ağıl onların bizim vəhdətimizi dərk etmələri üçün kafidir, amma

وَمَا كُنَّا ظَالِمِينَ ﴿٢٠٩﴾ وَمَا تَنَزَّلَتْ بِهِ الشَّيَاطِينُ ﴿٢١٠﴾ وَمَا يَنْبَغِي لَهُمْ وَمَا يَسْتَطِيعُونَ ﴿٢١١﴾
اِنَّهُمْ عَنِ السَّمْعِ لَمَعْزُولُونَ ﴿٢١٢﴾ فَلَا تَدْعُ مَعَ اللّٰهِ اِلٰهًا اٰخَرَ فَتَكُونَ مِنَ الْمُعَذَّبِينَ ﴿٢١٣﴾ وَاَنْذِرْ
عَشِيرَتَكَ الْاَقْرَبِينَ ﴿٢١٤﴾

---

insanların əksəriyyəti nəfsani arzularına uyub, qəflətdə olduqlarından onlara peyğəmbərlər göndərdik. Belə ki, qəflət pərdəsini onlardan götürüb vəhdətimizi anlasınlar). (وَمَا كُنَّا ظَالِمِينَ) – **biz zalım deyilik, (əgər peyğəmbər xalqı imana dəvət edəndən sonra yenə inanmayıb, küfr və şirk içində qalsalar, yenə onlara zülm etməyib, əməllərinin cəzasını verərik. Əzab göndərib həlak edərik).**

**210)** (وَمَا تَنَزَّلَتْ بِهِ الشَّيَاطِينُ) - (müşriklər deyirdilər: "Bu Quranı Məhəmmədin qəlbinə özləri kimi şeytanlar nazil edir." Allah-Təala da onların cavabında buyurur: "Bu Quranı Məhəmmədin qəlbinə) **şeytanlar nazil etməyib.**

**211)** (وَمَا يَنْبَغِي لَهُمْ) – (şeytanların şanı bunu etməkdən əskikdir)**, onlara layiq deyil,** (وَمَا يَسْتَطِيعُونَ) – (istəsələr də) **bacarmazlar,** (Quran fəsahət və bəlağətdə ən yüksək dərəcədə olduğundan onu nazil etməyə gücləri çatmaz)**.**

**212)** (اِنَّهُمْ عَنِ السَّمْعِ لَمَعْزُولُونَ) - **həqiqətən,** (şeytanlar - sizin kimi müşriklər Allah-Təalanın vəhyini və hikmətamiz kəlamlarını) **eşitməkdən uzaqdırlar.** (Belə bir kəlamı necə düzəldib, Hz. Məhəmmədə öyrətsinlər? Müşriklər cin və şeytanların bəzi insanlara söz öyrətdiyinə inandıqlarından Allah-Təala da onların etiqadına görə cavab verir, lakin burada şeytanlardan məqsəd şeytani insanlardır)**.**

**213)** (فَلَا تَدْعُ مَعَ اللّٰهِ اِلٰهًا اٰخَرَ فَتَكُونَ مِنَ الْمُعَذَّبِينَ) - (ey Məhəmməd)**, Allah-Təala* ilə yanaşı başqa bir məbuda ibadət etmə,** (belə bir iş görsən, qiyamət günündə) **əzab edilənlərdən olarsan.**

*(*Qeyd: Xitab peyğəmbərədir, lakin məqsəd onun ümmətinə şirki qadağan etməkdir. Bir insan din və dünya işlərində Allah-Təaladan başqa hər hansı bir kəsdən yardım istəsə, o şəxs müşriklərdən hesab olunub qiyamət günündə onlarla bir olar. Biz İslam ümməti Qurani-Şərifin açıq-aşkar nəsihətlərini qəbul etməyib faydalanmırıq, İslam ümmətinin hər bir fərdi özündən ötrü bir rəhbər seçib ehtiyacını ondan istəyir. Qurani-Şərifin bu ayələrinə baxıb, gərək, söz və əməllərimizə diqqət edək və özümüzü şirk və zəlalət vadisindən xilas edək. İlahi, bizə bir bəsirət ver).*

**214)** (وَاَنْذِرْ عَشِيرَتَكَ الْاَقْرَبِينَ) - (ey Məhəmməd)**, ən yaxın qohum-əqrəbanı** (əzabımızla) **qorxut.** (Bəlkə, imana daxil olub küfr və şirkdən uzaq olsunlar)**.** (Əlaəddin Əli ibn Məhəmməd Xazin öz təfsiri "Lübabüt-təvil"də həmin ayənin təfsirində Məhəmməd ibn İshaqdan, o da öz sənədi ilə Əli ibn Əbu Talibdən rəvayət edir. Hz. Əli (ə.s), deyir: "Bu ayə peyğəmbərə nazil olduqda,

وَاخْفِضْ جَنَاحَكَ لِمَنِ اتَّبَعَكَ مِنَ الْمُؤْمِنِينَ ﴿٢١٥﴾ فَإِنْ عَصَوْكَ فَقُلْ إِنِّي بَرِيءٌ مِمَّا تَعْمَلُونَ
﴿٢١٦﴾ وَتَوَكَّلْ عَلَى الْعَزِيزِ الرَّحِيمِ ﴿٢١٧﴾ الَّذِي يَرَاكَ حِينَ تَقُومُ ﴿٢١٨﴾ وَتَقَلُّبَكَ فِي
السَّاجِدِينَ ﴿٢١٩﴾ إِنَّهُ هُوَ السَّمِيعُ الْعَلِيمُ ﴿٢٢٠﴾ هَلْ أُنَبِّئُكُمْ عَلَى مَنْ تَنَزَّلُ الشَّيَاطِينُ ﴿٢٢١﴾

---

məni çağırıb buyurdu: “Ey Əli, Allah-Təala mənə əmr edib ki, öz qohumlarımı və əmilərimi Allah-Təala yoluna dəvət edim, bir süfrə aç, ondan sonra get Əbdülmüttəlib nəslini dəvət et.” Hz. (Əli əs.), deyir: “Mən süfrə açıb ondan sonra gedib əmilərimi və digər Əbdülmüttəlib övladlarını dəvət etdim. Onların arasında Əbu Talib, Həmzə, Abbas, Əbu Ləhəb də var idi. Yeməkdən sonra Hz. Peyğəmbər buyurdu: “Ey Əbdülmüttəlib övladları, mən sizə dünya və axirətin xeyrini gətirmişəm, Allah-Təala mənə əmr edib ki, sizi onun tərəfinə dəvət edim. Kim sizdən mənə kömək və qardaş olub, varisim və canişinim olacaq?” Əbdülmüttəlib övladlarından orada 40-a qədər adam var idi. Heç biri cavab vermədi. Onların içində ən kiçiyi mən idim. Dedim: “Ey peyğəmbər, mən sənə kömək və qardaş olaram.” Hz. peyğəmbər boynumdan yapışıb dedi: “Bu mənim qardaşım, varisim və canişinimdir. Gərək, buna itaət edəsiniz.” Camaat gülə-gülə durub gedəndə Əbu Talibə dedilər: “Qardaşın oğlu sənə əmr edir ki, gərək, oğlun Əliyə itaət edəsən.” (Bu rəvayət uzundur, müxtəsər nəql olundu)**.**

**215)** (وَاخْفِضْ جَنَاحَكَ لِمَنِ اتَّبَعَكَ مِنَ الْمُؤْمِنِينَ) – (ey Məhəmməd)**, sənə tabe olan möminlərə qarşı təvazökar ol,** (təkəbbürlü olma. Allah-Təala bu ayədə müsəlmanlara onlara tabe olanlara və himayə etdiklərinə qarşı necə olmaları gərəkdiyini öyrədir)**.**

**216)** (فَإِنْ عَصَوْكَ فَقُلْ إِنِّي بَرِيءٌ مِمَّا تَعْمَلُونَ) – (ey Məhəmməd)**, əgər sənə asi olub** (sözlərinə qulaq asıb itaət etməsələr)**, sən də onlara de ki, həqiqətən, etdiklərinizdən uzağam.**

**217)** (وَتَوَكَّلْ عَلَى الْعَزِيزِ الرَّحِيمِ)– (düşməninə) **qalib** (olan, dostuna) **rəhm edən Allah-Təalaya təvəkkül edib** (hər işini Ona həvalə et)**.**

**218-219)** (الَّذِي يَرَاكَ حِينَ تَقُومُ وَتَقَلُّبَكَ فِي السَّاجِدِينَ) – (o Allah-Təalaya təvəkkül et ki, gecə) **namaz qılanda da, səcdə edənlərin arasında gəzib dolananda da səni görür** (və əhvalından agahdır. Gecə namazını qılandan sonra camaatın arasında gəz, dolan ki, kim gecə namaz qılır, kim qılmır, biləsən)**.**

**220)** (إِنَّهُ هُوَ السَّمِيعُ الْعَلِيمُ) **- həqiqətən, Allah-Təala** (danışdıqlarınızı) **eşidib,** (etdiklərinizdən) **agahdır.**

**221)** (هَلْ أُنَبِّئُكُمْ عَلَى مَنْ تَنَزَّلُ الشَّيَاطِينُ) – (siz müşriklər bu Quranı şeytanların nazil edib, Məhəmmədə gətirdiyini deyirsiniz. Amma Hz. Məhəmmədə şeytan nazil olmaz)**. Şeytanların kimə nazil olub** (təlim etdiyini) **sizə xəbər verimmi?**

تَنَزَّلُ عَلٰى كُلِّ اَفَّاكٍ اَثِيمٍۙ ﴿٢٢٢﴾ يُلْقُونَ السَّمْعَ وَاَكْثَرُهُمْ كَاذِبُونَۜ ﴿٢٢٣﴾ وَالشُّعَرَٓاءُ يَتَّبِعُهُمُ
الْغَاوُنَۜ ﴿٢٢٤﴾ اَلَمْ تَرَ اَنَّهُمْ فِي كُلِّ وَادٍ يَهٖيمُونَۙ ﴿٢٢٥﴾

---

**222)** (تَنَزَّلُ عَلٰى كُلِّ اَفَّاكٍ اَثِيمٍ) – (şeytanlar) **hər bir yalançıya, fasiqə nazil olar,** (nəinki bizim peyğəmbərimiz Hz. Məhəmmədə (ə.s), ərəblər cahiliyyə zamanında kahinlərin, falçıların əməllərini şeytanlara isnad edib deyirdilər: "Hər bir kahinin bir şeytanı var, ona təlim edir", -o cümlədən kahinlərdən Satih, Şıqq, Müseyləmə, Tüleymə kimi şəxslərin əməllərini şeytana isnad etdiklərindən Hz. Peyğəmbərin gətirdiyi Qurani-Şərifi də onlarla müqayisə edib, şeytana isnad etdilər. Allah-Təala onların öz etiqadlarına görə, ayədə onlara cavab verdi. Yoxsa, həqiqətən, şeytanın insanlara nəsə öyrətdiyinə etiqad etmək cahiliyyə zamanının xurafatlarındandır)**.**

**223)** (يُلْقُونَ السَّمْعَ وَاَكْثَرُهُمْ كَاذِبُونَ) – (yalançı kahinlər, falçılar* şeytanlara) **qulaq asarlar ki,** (guya qeybdən bizə vəhy gətirib təlim edirlər)**, halbuki onların əksəriyyəti yalançıdır.**

*(*__Qeyd:__ Necə ki bu zamanda da belə iddialar edən şəxsləri görürsən, bəzi boş sözlər düzəldib, cin və şeytanlardan özünə hakim olanların vasitəsilə bu sözlərlə avam camaatı aldadıb, xeyli qazanc əldə edirlər. Biçarə avamlar da öldürücü xəstəliklərdə, məsələn, vərəm, ağciyər xəstəliyi, ürək xəstəlikləri, prostat, böyrək, sara, dəlilik kimi xəstəliklərdə həkimləri tərk edib, bu cür cindarların iddialarına əsasən onlara müraciət edirlər. Dua kitabları düzəldib, müxtəlif şəkillər, üçkünc, dördkünc, beşkünc, altıkünclü şəkillər çəkib, adını tilsim qoyub, avam camaat da o şəkilləri görəndə ağılları başlarından gedib onlara etiqad edirlər. Bunlar hamısı cəhalətdən qaynaqlanır. Elm nuru ilə aydınlanan millətlərdə belə xurafat sözlər meydana gəlməz. Xəbis cəhalət ağacının kökü islam ümmətinin içindən qoparılmasa, bu ümmətin nicat tapıb xeyrə qovuşacağına heç bir ümid yoxdur).*

**224)** (وَالشُّعَرَٓاءُ يَتَّبِعُهُمُ الْغَاوُنَ) – (həcv edən) **şairlər də** (falçılar kimi yalançıdırlar, onların sözlərinə ancaq səfeh və) **asi şəxslər tabe olar.**

**225)** (اَلَمْ تَرَ اَنَّهُمْ فِي كُلِّ وَادٍ يَهٖيمُونَ) **-** (ey Məhəmməd)**, bəs** (bu şairlərə) **baxıb görmürsən ki,** (kəlam) **vadilərində necə çaşqın və sərgərdan dolanırlar,** (xəsis şəxslərə Hatəm səxavətini və ya bir fasiqə İbrahim ibn Ədhəm təqvasını, ya da bir qorxağa Xalid ibn Vəlid şücaətini isnad edirlər. Qüreyşdən və Taif əhlindən Hz. Peyğəmbəri həcv edən bəzi şairlər var idi. Qüreyşdən Abdullah ibn Zibe\`ra və Hübeyrə ibn Əbu Vəhb, Müsafi\` ibn Əbdülmənaf və Əbu Amir əl-Cümahi, Taif əhlindən isə Ümeyyə ibn Əbus-Salt və onun kimi bəziləri Hz. Peyğəmbəri həcv edirdilər. Mədinədə Hz. Peyğəmbərin şairləri Həssan ibn Sabit və Abdullah ibn Rəvaha, Kə\`b ibnül-Malik, Kə\`b ibn Züheyr kimi şəxslər Hz. Peyğəmbər Mədinəyə hicrət edəndən sonra onlara cavab verdilər)**.**

وَاَنَّهُمْ يَقُولُونَ مَا لَا يَفْعَلُونَۙ ﴿٢٢٦﴾ اِلَّا الَّذ۪ينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ وَذَكَرُوا اللّٰهَ كَث۪يرًا
وَانْتَصَرُوا مِنْ بَعْدِ مَا ظُلِمُواۜ وَسَيَعْلَمُ الَّذ۪ينَ ظَلَمُوٓا اَيَّ مُنْقَلَبٍ يَنْقَلِبُونَ ﴿٢٢٧﴾

---

**226)** (وَاَنَّهُمْ يَقُولُونَ مَا لَا يَفْعَلُونَ) – (həcv deyən şairlərin yalançı olduqlarına bu kifayət edər ki,) **həqiqətən, onlar etmədiklərini deyirlər.**

**227)** (اِلَّا الَّذ۪ينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ وَذَكَرُوا اللّٰهَ كَث۪يرًا) – (şairlər öz sözlərinə əməl etməzlər)**, ancaq** (Allah-Təalaya) **iman gətirib, saleh əməl edib, Allah-Təalanı çox zikr edənlər istisnadır,** (şeir demək onları Allah-Təaladan qafil etməz)**.** (وَانْتَصَرُوا مِنْ بَعْدِ مَا ظُلِمُوا) **- onlara zülm olunub** (həcv edildikdən) **sonra intiqam alıb** (həcv etmələrində onlara heç bir eyib və nöqsan yoxdur)**.** (وَسَيَعْلَمُ الَّذ۪ينَ ظَلَمُوا اَيَّ مُنْقَلَبٍ يَنْقَلِبُونَ) – **zülm edənlər** (tezliklə ölüb əzab yerinə) **hara qayıdacaqlarını biləcəklər.**

Allaha həmd olsun, Şüəra surəsinin təfsiri bitdi. Allah-Təala bu mübarək surəni bu ayə ilə bitirməklə zalımların bütün ümidlərini yox edib, xəyallarına belə gəlməyən əzabı onlara vəd edir. Bu surədə zikr olunan 8 peyğəmbərin qissələrinə diqqət edən maarifpərvər şəxslərə insan təbiətinin həmişə əyləncəyə meyilli olub, haqdan qaçmaları, haqq danışan şəxslərin məğlub, cahil və nadan şəxslərin onlara qalib gəldiyi məxfi deyil. Hz. Peyğəmbər buyurubdur: "Şüəra surəsini kim oxusa, Allah-Təala ona 10 savab bəxş edər." (Qazi Beyzavi, Ənvarut-Tənzil, IV/501)



## ən-NƏML SURƏSİ

27-ci surədir. Məkkədə nazil olub, 93 ayə, 1317 kəlmə, 4799 hərfdir.



بِسْمِ اللّٰهِ الرَّحْمٰنِ الرَّح۪يمِ. طٰسٓ تِلْكَ اٰيَاتُ الْقُرْاٰنِ وَكِتَابٍ مُب۪ينٍۙ ﴿١﴾ هُدًى وَبُشْرٰى لِلْمُؤْمِن۪ينَۙ
﴿٢﴾ اَلَّذ۪ينَ يُق۪يمُونَ الصَّلٰوةَ وَيُؤْتُونَ الزَّكٰوةَ وَهُمْ بِالْاٰخِرَةِ هُمْ يُوقِنُونَ ﴿٣﴾ اِنَّ الَّذ۪ينَ لَا يُؤْمِنُونَ
بِالْاٰخِرَةِ زَيَّنَّا لَهُمْ اَعْمَالَهُمْ فَهُمْ يَعْمَهُونَۜ ﴿٤﴾ اُو۬لٰٓئِكَ الَّذ۪ينَ لَهُمْ سُٓوءُ الْعَذَابِ وَهُمْ فِي الْاٰخِرَةِ هُمُ
الْاَخْسَرُونَ ﴿٥﴾ وَاِنَّكَ لَتُلَقَّى الْقُرْاٰنَ مِنْ لَدُنْ حَك۪يمٍ عَل۪يمٍ ﴿٦﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1)** (طٰسٓ) **- bu surənin adıdır.** (تِلْكَ اٰيَاتُ الْقُرْاٰنِ وَكِتَابٍ مُب۪ينٍ) **- bu** (surədə zikr olunan ayələr) **Qurani-Şərifin və** (elmi, halal və haramı bəyan edən) **açıq-aydın kitabın ayələridir.**

**2)** (هُدًى وَبُشْرٰى لِلْمُؤْمِن۪ينَ) – (bu surədə zikr olunan ayələr) **möminlərdən ötrü** (haqq yoluna) **hidayət və cənnətə müjdədir.**

**3)** (اَلَّذ۪ينَ يُق۪يمُونَ الصَّلٰوةَ وَيُؤْتُونَ الزَّكٰوةَ وَهُمْ بِالْاٰخِرَةِ هُمْ يُوقِنُونَ) – (möminlərin xüsusiyyətlərindən biri) **odur ki, namaz qılıb zəkat verib, axirət gününə möhkəm inanarlar.**

**4)** (اِنَّ الَّذ۪ينَ لَا يُؤْمِنُونَ بِالْاٰخِرَةِ زَيَّنَّا لَهُمْ اَعْمَالَهُمْ فَهُمْ يَعْمَهُونَ) **- həqiqətən, o şəxslər ki axirətə inanmır,** (müşrik olub küfr içində qaldıqları üçün xəbis) **əməllərini özlərinə gözəl göstərərik. Belə ki,** (küfr və zəlalətlərində) **çaşqın və sərgərdan qalarlar.**

**5)** (اُو۬لٰٓئِكَ الَّذ۪ينَ لَهُمْ سُٓوءُ الْعَذَابِ) – (axirətə iman gətirməyənlərdən ötrü şiddətli və) **pis bir əzab vardır.** (وَهُمْ فِي الْاٰخِرَةِ هُمُ الْاَخْسَرُونَ) **- əlbəttə, axirətdə hər kəsdən çox** (özünə) **zərər verib düçar olanlar da onlardır.**

**6)** (وَاِنَّكَ لَتُلَقَّى الْقُرْاٰنَ مِنْ لَدُنْ حَك۪يمٍ عَل۪يمٍ) - (ey Məhəmməd)**, həqiqətən, Quran sənə hikmət və elm sahibi Allah-Təala tərəfindən bəxş olunubdur.** (Bu kafir və müşriklər ona şəkk-şübhə etsələr də, onda heç bir şəkk-şübhə yoxdur. Bəlkə, küfr və inadlarından ona şəkk-şübhə edirlər. Bu ayə bundan sonra zikr olunacaq peyğəmbərlərin qissələrindən ötrü müqəddimədir, yəni bundan sonra gələn qissələr hikmətə şamil olub insanların ibrət almasından ötrü zikr olunubdur)**.**

اِذْ قَالَ مُوسٰى لِاَهْلِهٖٓ اِنّٖٓي اٰنَسْتُ نَارًاۜ سَاٰتٖيكُمْ مِنْهَا بِخَبَرٍ اَوْ اٰتٖيكُمْ بِشِهَابٍ قَبَسٍ لَعَلَّكُمْ تَصْطَلُونَ
﴿٧﴾ فَلَمَّا جَٓاءَهَا نُودِيَ اَنْ بُورِكَ مَنْ فِي النَّارِ وَمَنْ حَوْلَهَاۜ وَسُبْحَانَ اللّٰهِ رَبِّ الْعَالَمٖينَ ﴿٨﴾ يَا
مُوسٰٓى اِنَّهُٓ اَنَا اللّٰهُ الْعَزٖيزُ الْحَكٖيمُۙ ﴿٩﴾ وَاَلْقِ عَصَاكَۜ فَلَمَّا رَاٰهَا تَهْتَزُّ كَاَنَّهَا جَٓانٌّ وَلّٰى مُدْبِرًا وَلَمْ
يُعَقِّبْۜ يَا مُوسٰى لَا تَخَفْ اِنّٖي لَا يَخَافُ لَدَيَّ الْمُرْسَلُونَۗ ﴿١٠﴾ اِلَّا مَنْ ظَلَمَ ثُمَّ بَدَّلَ حُسْنًا بَعْدَ
سُٓوءٍ فَاِنّٖي غَفُورٌ رَحٖيمٌ ﴿١١﴾

---

**7)** (اِذْ قَالَ مُوسٰى لِاَهْلِهٖٓ اِنّٖٓي اٰنَسْتُ نَارًا) – **bir zaman Musa** (Mədyəndən çıxıb Misirə gedəndə gecə vaxtı ona od lazım olub) **ailəsinə demişdi: “Həqiqətən, mən** (uzaqdan) **od görürəm.** (سَاٰتٖيكُمْ مِنْهَا بِخَبَرٍ) – (siz burada durun,) **mən də** (o odun səbəbinə yoldan) **sizə bir xəbər gətirim.** (Sonra da yolumuza davam edək. Onlar gecənin qaranlığında yolu azmışdılar)**.** (اَوْ اٰتٖيكُمْ بِشِهَابٍ قَبَسٍ لَعَلَّكُمْ تَصْطَلُونَ) **- ya da** (əgər yolu tapa bilməsəm)**, sizin üçün bir parça köz gətirim, bəlkə, qızınasınız.**

**8)** (فَلَمَّا جَٓاءَهَا نُودِيَ اَنْ بُورِكَ مَنْ فِي النَّارِ وَمَنْ حَوْلَهَا)- (ey Məhəmməd, Musa gedib oda) **çatdıqda,** (təzə bir ağacın alovlanıb yandığını gördü, amma od ağaca heç bir təsir etmirdi, Musa çaşqın qalıb ağaca baxırdı. Və bizim tərəfimizdən) **ona belə deyildi: “Ey Musa, odun yanında duran şəxs** (Musa) **və bu odun ətrafındakı** (yerlər) **xeyirli, bərəkətli olsun.** (وَسُبْحَانَ اللّٰهِ رَبِّ الْعَالَمٖينَ) **- aləmlərə tərbiyə verən Allah-Təala hər bir eyibdən pak və müqəddəsdir.** (Yəni bu təzə ağacın alovlanıb yanması əbəs olmayıb Allah-Təalanın hikməti üzrədir)**.**

**9)** (يَا مُوسٰٓى اِنَّهُٓ اَنَا اللّٰهُ الْعَزٖيزُ الْحَكٖيمُ) **- ey Musa, həqiqətən,** (düşmənə) **qalib** (olub intiqam alan və hər şeyi) **hikmətlə edən Allah-Təala mənəm.**

**10)** (وَاَلْقِ عَصَاكَ) – (ey Musa, əlindəki) **əsanı** (yerə) **at,** (Musa əsanı yerə atdı, Allah-Təalanın əmri ilə əsa əjdəha oldu)**.** (فَلَمَّا رَاٰهَا تَهْتَزُّ كَاَنَّهَا جَٓانٌّ وَلّٰى مُدْبِرًا وَلَمْ يُعَقِّبْ) – (Musa əsanın əjdəha boyda olub) **ilan kimi hərəkət etdiyini gördükdə dönüb qaçdı, arxaya da baxmadı,** (يَا مُوسٰى لَا تَخَفْ) – (Musaya dedik:) **ey Musa, qorxub** (qaçma)**.** (اِنّٖي لَا يَخَافُ لَدَيَّ الْمُرْسَلُونَ) **- həqiqətən, mən** (aman verəndən sonra) **peyğəmbərlər mənim yanımda** (heç bir şeydən) **qorxmazlar.** (Bu qorxu məqamı deyil, möcüzə məqamıdır)**.**

**11)** (اِلَّا مَنْ ظَلَمَ ثُمَّ بَدَّلَ حُسْنًا بَعْدَ سُٓوءٍ فَاِنّٖي غَفُورٌ رَحٖيمٌ) **- lakin** (peyğəmbərlərdən) **kim** (özünə) **zülm edib,** (Adəm, Davud, Süleyman və Musanın özü kimi ona layiq olmayan əməl etsə)**, sonra tövbə edib pisi yaxşıya çevirsə, həqiqətən, o vaxt mən** (onlara) **rəhm edib bağışlayanam.** (Necə ki zikr olunan peyğəmbərlərdən özlərinə layiq olmayan əməli edib sonra tövbə edənlərin tövbəsini Allah-Təala qəbul etdi)**.**

وَاَدْخِلْ يَدَكَ فِي جَيْبِكَ تَخْرُجْ بَيْضَآءَ مِنْ غَيْرِ سُوٓءٍ فِي تِسْعِ اٰيَاتٍ اِلٰى فِرْعَوْنَ وَقَوْمِهِ اِنَّهُمْ كَانُوا قَوْمًا فَاسِقِينَ ﴿١٢﴾ فَلَمَّا جَآءَتْهُمْ اٰيَاتُنَا مُبْصِرَةً قَالُوا هٰذَا سِحْرٌ مُبِينٌ ﴿١٣﴾ وَجَحَدُوا بِهَا وَاسْتَيْقَنَتْهَآ اَنْفُسُهُمْ ظُلْمًا وَعُلُوًّا فَانْظُرْ كَيْفَ كَانَ عَاقِبَةُ الْمُفْسِدِينَ ﴿١٤﴾ وَلَقَدْ اٰتَيْنَا دَاوُدَ وَسُلَيْمٰنَ عِلْمًا وَقَالَا الْحَمْدُ لِلّٰهِ الَّذِي فَضَّلَنَا عَلٰى كَثِيرٍ مِنْ عِبَادِهِ الْمُؤْمِنِينَ ﴿١٥﴾

---

**12)** (وَاَدْخِلْ يَدَكَ فِي جَيْبِكَ تَخْرُجْ بَيْضَاءَ مِنْ غَيْرِ سُوءٍ) – (ey Musa)**, əlini qoynuna sal ki, əlini oradan çıxaranda** (baras ağlığı kimi yox) **qüsursuz** (şimşək parıltısı kimi) **ağappaq çıxsın.** (فِي تِسْعِ اٰيَاتٍ اِلٰى فِرْعَوْنَ وَقَوْمِهِ) – (ey Musa, get,) **firon və onun qövmü** (qibtiləri bu iki möcüzədən başqa) **9 möcüzə ilə** (bizim tərəfimizə dəvət et. Allah-Təalanın Musaya ağ əl və əsanın əjdəha olmasından başqa bəxş etdiyi 9 möcüzə bunlardır: 1) qibtilərə çəyirtkələr hücum edib, bütün əkinlərini yeyib məhv etdi 2) gənələr hücum edib bədənlərini parçaladı 3) qurbağalar hücum edib bütün qabları, yeməkləri qurbağa ilə doldu 4) yeyib-içdiyi şeylərin hamısı qana döndü 5) heyvanları həlak oldu 6) çöllərində ot-ələf bitmədi 7) əkin məhsulları azaldı 8) dəniz bəni-İsraildən ötrü yarıldı 9) tufan olub firon və qibtilər qərq oldu. Allah-Təala bu 11 möcüzəni Musaya bəxş edib onu qibtiləri dəvət etməsi üçün göndərdi)**.** (اِنَّهُمْ كَانُوا قَوْمًا فَاسِقِينَ) **- həqiqətən,** (firon və onun camaatı) **fasiq bir qövm idilər.** (Bu möcüzələrə itaət etməyib iman gətirmədilər)**.**

**13)** (فَلَمَّا جَاءَتْهُمْ اٰيَاتُنَا مُبْصِرَةً) **- bizim açıq-aşkar möcüzələrimiz** (qibtilərə) **gəldikdə,** (قَالُوا هٰذَا سِحْرٌ مُبِينٌ) **- dedilər: "Bu açıq-aşkar sehrdir.** (Biz buna tabe olmarıq)**."**

**14)** (وَجَحَدُوا بِهَا وَاسْتَيْقَنَتْهَا اَنْفُسُهُمْ ظُلْمًا وَعُلُوًّا)**– onun həqiqət olduğuna qəlbən inansalar da, özlərinə zülm edib, təkəbbürləndiklərindən** (Musanın möcüzələrini) **inkar etdilər.** (Bundan böyük nə zülm olar ki, inadkarlıqdan kafir olub inkar etdilər)**.** (فَانْظُرْ كَيْفَ كَانَ عَاقِبَةُ الْمُفْسِدِينَ) - (ey Məhəmməd)**, bax gör ki, fitnə-fəsadçıların** (Musanı inkar edən qibtilərin) **aqibəti necə oldu?** (Hamısı dənizdə qərq olub həlak oldular)**.**

**15)** (وَلَقَدْ اٰتَيْنَا دَاوُدَ وَسُلَيْمٰنَ عِلْمًا) **– Davud və Süleymana da** (siyasət və hər cür hikmət) **elmini bəxş etdik.** (وَقَالَا الْحَمْدُ لِلّٰهِ الَّذِي فَضَّلَنَا عَلٰى كَثِيرٍ مِنْ عِبَادِهِ الْمُؤْمِنِينَ) **–** (Davud və Süleyman onlara bəxş olunan nemətlərin müqabilində həmd-səna edib) **dedilər: "O Allah-Təalaya həmd edirik ki, bizi mömin bəndələrinin çoxundan üstün* etdi."**

*(*Qeyd: Bu ayə elmin şərəfinə, ən üstün nemət olmasına və elm əhlinin ucalığına, bütün insanlar arasında hörmət sahibi olduğuna işarə edir. Allah-Təala kimə elm bəxş edibsə, o şəxsə öz tay-tuşları arasında üstünlük verib ucaldıbdır. Hz. Peyğəmbərin öz möcüzəli kəlamları ilə üləmanı peyğəmbərlərə varis elan etməsinin səbəbi odur ki,*

وَوَرِثَ سُلَيْمٰنُ دَاوُدَ وَقَالَ يَٓا اَيُّهَا النَّاسُ عُلِّمْنَا مَنْطِقَ الطَّيْرِ وَاُوتِينَا مِنْ كُلِّ شَيْءٍۜ اِنَّ هٰذَا لَهُوَ الْفَضْلُ
الْمُبِينُ ﴿١٦﴾ وَحُشِرَ لِسُلَيْمٰنَ جُنُودُهُ مِنَ الْجِنِّ وَالْاِنْسِ وَالطَّيْرِ فَهُمْ يُوزَعُونَ ﴿١٧﴾ حَتّٰٓى اِذَٓا
اَتَوْا عَلٰى وَادِ النَّمْلِۙ قَالَتْ نَمْلَةٌ يَٓا اَيُّهَا النَّمْلُ ادْخُلُوا مَسَاكِنَكُمْۚ لَا يَحْطِمَنَّكُمْ سُلَيْمٰنُ وَجُنُودُهُۙ وَهُمْ
لَا يَشْعُرُونَ ﴿١٨﴾

---

*üləma elmin şərəfi baxımından digər insanlardan daha çox peyğəmbərlərə yaxındırlar. Kimdə bu uca nemət varsa, şükür etməsi lazımdır, amma insanlara qarşı təvazökar olub, gərək, təkəbbürlənməsin. Necə ki Ömər ibn Xəttab: "Cəmi insanlar Ömərdən daha fəqih və alimdir", demişdir və necə ki Əli ibn Əbu Talib demişdi ki, əgər öz fəzilətini bəyan etmək eyib sayılmasaydı, özünün çox fəzilətini zikr edərdi. Amma bizim bu dövrdə elmdən məhrum olduğu halda, özlərini üləma adlandıranlar bir az qrammatika bilgisi, morfologiya – "ta`zif" (cəm halı), "ləfifi-maqrun", "ləfifi-məfruq" (əlif, vav, yə kimi ərəbcə illət hərflərinin işlənmə forması), bir az da sintaksis - mübtəda, xəbər, tamamlıq, təyin nədir bilirlərsə, özlərini bütün dünya elmlərinə sahib hesab edib camaatı özlərinə qul, özlərini də onlara ruhani və cismani rəhbər zənn edirlər).*

**16)** (وَوَرِثَ سُلَيْمٰنُ دَاوُدَ) – (elm, hikmət və peyğəmbərlikdə digər oğulları yox, ancaq) **Süleyman Davuda varis oldu,** (Davudun 19 oğlu var idi. Allah-Təala onların arasından Süleymanı seçib peyğəmbər etdi)**.** (وَقَالَ يَٓا اَيُّهَا النَّاسُ عُلِّمْنَا مَنْطِقَ الطَّيْرِ) – (Süleyman Allah-Təalanın nemətini görüb iqrar etmək üçün camaata xitab edib) **dedi: "Ey insanlar,** (Allah-Təala tərəfindən bizə) **quş dili öyrədildi.** (İnsanın və ya heyvanın ağzından çıxan səsə nitq deyilir və quşlar özlərinə məxsus olan səslərlə bir-birilərini anlayıb dərk edirlər. Allah-Təalanın bu quş dilini Süleymana öyrətməsi qəribə bir iş deyildir. Allah-Təala insanlara o qədər elm gücü bəxş edib ki, onun sayəsində dövrümüzdə bəzi heyvanların səsini əzbərləyib, o şəkildə onlarla danışıb anlaşan zooloqlar da var)**.** (وَاُوتِينَا مِنْ كُلِّ شَيْءٍ) – (Süleyman deyir: "Allah-Təala tərəfindən quşların dilindən başqa peyğəmbərlik, hakimiyyət və digər) **hər bir şeydən bizə bəxş edildi.** (اِنَّ هٰذَا لَهُوَ الْفَضْلُ الْمُبِينُ) **- həqiqətən, bu,** (Allah-Təalanın bizə bəxş etdiyi nemətlər) **açıq-aşkar bir lütfdür.** (Gərək, bu nemətlərə layiq olub haqqı ilə işlədək)**.**

**17)** (وَحُشِرَ لِسُلَيْمٰنَ جُنُودُهُ مِنَ الْجِنِّ وَالْاِنْسِ وَالطَّيْرِ فَهُمْ يُوزَعُونَ) – (ey Məhəmməd)**, Süleymanın** (əmriylə) **cinlərdən, insanlardan və quşlardan ibarət qoşunu toplandı. Hamısı nizamla** (bir-birilərinə bitişik halda) **hərəkət edirdi.**

**18)** (حَتّٰٓى اِذَٓا اَتَوْا عَلٰى وَادِ النَّمْلِ) **- gedib qarışqa çölünə çatdıqda,** (قَالَتْ نَمْلَةٌ يَٓا اَيُّهَا النَّمْلُ ادْخُلُوا مَسَاكِنَكُمْ) – (qarışqalar Süleymanın qoşununu* gördükdə) **bir qarışqa** (digər qarışqalara) **dedi: "Ey qarışqalar, yuvalarınıza girin** (لَا يَحْطِمَنَّكُمْ سُلَيْمٰنُ وَجُنُودُهُ وَهُمْ لَا يَشْعُرُونَ) **- ki, Süleyman və onun qoşunu** (sizin burda olduğunuzu) **bilmədikləri üçün sizi tapdalayıb əzməsinlər.**

*(***Qeyd:** Allah-Təala bu ayədə dərin bir mənanı və böyük bir faydanı ehtiva edib heyvanatın ən zəifi olan qarışqanı insanların ən qüdrətlisi olan Süleyman ibn Davuda*

فَتَبَسَّمَ ضَاحِكًا مِنْ قَوْلِهَا وَقَالَ رَبِّ اَوْزِعْنِي اَنْ اَشْكُرَ نِعْمَتَكَ الَّتِي اَنْعَمْتَ عَلَيَّ وَعَلٰى وَالِدَيَّ وَاَنْ اَعْمَلَ صَالِحًا تَرْضٰيهُ وَاَدْخِلْنِي بِرَحْمَتِكَ فِي عِبَادِكَ الصَّالِحِينَ ﴿١٩﴾ وَتَفَقَّدَ الطَّيْرَ فَقَالَ مَا لِيَ لَٓا اَرَى الْهُدْهُدَۘ اَمْ كَانَ مِنَ الْغَٓائِبِينَ ﴿٢٠﴾ لَاُعَذِّبَنَّهُ عَذَابًا شَدِيدًا اَوْ لَاَاذْبَحَنَّهُٓ اَوْ لَيَأْتِيَنِّي بِسُلْطَانٍ مُبِينٍ ﴿٢١﴾ فَمَكَثَ غَيْرَ بَعِيدٍ فَقَالَ اَحَطْتُ بِمَا لَمْ تُحِطْ بِهِ وَجِئْتُكَ مِنْ سَبَاٍ بِنَبَاٍ يَقِينٍ ﴿٢٢﴾ اِنِّي وَجَدْتُ امْرَاَةً تَمْلِكُهُمْ وَاُوتِيَتْ مِنْ كُلِّ شَيْءٍ وَلَهَا عَرْشٌ عَظِيمٌ ﴿٢٣﴾

---

*qarşı çıxarıb, zəif bir məxluqun güclü bir məxluqun zülmündən qaçıb gizlənməsini qarışqanın dili ilə ifadə edib möminlərə nəsihət edir. Güclü, vəzifəli şəxslər, gərək, elə olmasınlar ki, zəiflər onları görəndə qorxub gizlənsinlər. Hərçənd ayədən Süleyman ibn Davudun ədalətli olduğu məlum olur, çünki qarışqa deyir ki, Süleyman və onun qoşunu ola bilər ki, sizin bu məkanda olduğunuzu bilməyib, sizi ayaqlayıb həlak etsinlər. Yəni əgər Süleyman və onun qoşunu sizdən xəbərdar olsalar, qəsdən sizə zülm edib həlak etməzlər. Amma bu mətləbdə başqa bir incə məna da var, o da budur ki, rəhbər şəxslər, gərək, özlərinə tabe olanlardan xəbərsiz olmasınlar ki, bilərək və ya bilməyərək özü və ya başqaları tərəfindən də onlara zülm edilməsin. Bu ayə padşahlar və hakimlərə məxsus bir öyüd-nəsihətdir).*

**19)** (فَتَبَسَّمَ ضَاحِكًا مِنْ قَوْلِهَا) – (Süleyman qarışqanın bu) **sözünə** (təəccüb edib) **gülümsədi.** (وَقَالَ رَبِّ اَوْزِعْنِي اَنْ اَشْكُرَ نِعْمَتَكَ الَّتِي اَنْعَمْتَ عَلَيَّ وَعَلٰى وَالِدَيَّ) – (Süleyman qarışqanın bu sözündən özünün ədalətini anlayıb dua edərək) **dedi: "Ey mənim rəbbim, məni müvəffəq et ki, özümə və ata-anama bəxş etdiyin nemətlərə şükür edim.** (وَاَنْ اَعْمَلَ صَالِحًا تَرْضٰيهُ) **- və sənin razı qalacağın saleh** (qüsursuz və riyasız) **əməl edim,** (وَاَدْخِلْنِي بِرَحْمَتِكَ فِي عِبَادِكَ الصَّالِحِينَ) **- öz lütf və rəhmətinlə məni saleh bəndələrinin** (cənnətliklərin) **sırasına daxil et.**

**20)** (وَتَفَقَّدَ الطَّيْرَ) – (Süleyman) **quşları yoxlayıb** (onların arasında hüdhüdü görmədi). (فَقَالَ مَا لِيَ لَٓا اَرَى الْهُدْهُدَ اَمْ كَانَ مِنَ الْغَٓائِبِينَ) **- dedi: "**(Mənə nə olub?) **niyə hüdhüdu** (şanapipiyi) **görmürəm? Yoxsa qaibdir?**

**21)** (لَاُعَذِّبَنَّهُ عَذَابًا شَدِيدًا) – (izinsiz getdiyindən) **ona şiddətli əzab edərəm,** (onu həmcinsi olmayan quşlarla bir yerdə saxlayıb həbs edərəm). (اَوْ لَاَاذْبَحَنَّهُٓ) **- ya da tutub** (başını) **kəsərəm.** (اَوْ لَيَأْتِيَنِّي بِسُلْطَانٍ مُبِينٍ) **- ya da mənə** (müqəssir olmadığına dair) **açıq-aşkar bir dəlil gətirsin."** (O vaxt ona bir zərər dəyməz).

**22)** (فَمَكَثَ غَيْرَ بَعِيدٍ) **– az sonra** (hüdhüd) **gəldi.** (Süleyman soruşdu ki, harada idin?) (فَقَالَ اَحَطْتُ بِمَا لَمْ تُحِطْ بِهِ) – (hüdhüd) **dedi: "Sənin bilmədiyin bir şeyi öyrəndim.** (وَجِئْتُكَ مِنْ سَبَاٍ بِنَبَاٍ يَقِينٍ) **- Səba** (şəhərindən) **sənə doğru bir xəbər gətirmişəm.**

**23)** (اِنِّي وَجَدْتُ امْرَاَةً تَمْلِكُهُمْ) **- həqiqətən,** (o Səba şəhərində) **onlara padşah olan bir qadın gördüm.** (وَاُوتِيَتْ مِنْ كُلِّ شَيْءٍ وَلَهَا عَرْشٌ عَظِيمٌ) – (Allah-Təala tərəfindən şahlara lazım olan) **hər şey ona verilib və böyük bir taxtı var.**

وَجَدْتُهَا وَقَوْمَهَا يَسْجُدُونَ لِلشَّمْسِ مِنْ دُونِ اللّٰهِ وَزَيَّنَ لَهُمُ الشَّيْطَانُ اَعْمَالَهُمْ فَصَدَّهُمْ عَنِ السَّبِيلِ فَهُمْ
لَا يَهْتَدُونَ ﴿٢٤﴾ اَلَّا يَسْجُدُوا لِلّٰهِ الَّذِي يُخْرِجُ الْخَبْءَ فِي السَّمٰوَاتِ وَالْاَرْضِ وَيَعْلَمُ مَا تُخْفُونَ
وَمَا تُعْلِنُونَ ﴿٢٥﴾ اَللّٰهُ لَٓا اِلٰهَ اِلَّا هُوَ رَبُّ الْعَرْشِ الْعَظِيمِ ﴿٢٦﴾ قَالَ سَنَنْظُرُ اَصَدَقْتَ اَمْ كُنْتَ مِنَ
الْكَاذِبِينَ ﴿٢٧﴾ اِذْهَبْ بِكِتَابِي هٰذَا فَاَلْقِهْ اِلَيْهِمْ ثُمَّ تَوَلَّ عَنْهُمْ فَانْظُرْ مَاذَا يَرْجِعُونَ ﴿٢٨﴾ قَالَتْ يَٓا
اَيُّهَا الْمَلَؤُا اِنّ۪ٓي اُلْقِيَ اِلَيَّ كِتَابٌ كَرِيمٌ ﴿٢٩﴾ اِنَّهُ مِنْ سُلَيْمٰنَ وَاِنَّهُ بِسْمِ اللّٰهِ الرَّحْمٰنِ الرَّح۪يمِۙ ﴿٣٠﴾
اَلَّا تَعْلُوا عَلَيَّ وَأْتُونِي مُسْلِمِينَ ﴿٣١﴾

---

**24)** (وَجَدْتُهَا وَقَوْمَهَا يَسْجُدُونَ لِلشَّمْسِ مِنْ دُونِ اللّٰهِ) **- onun** (adına Bəlqis deyilir) **və qövmünün Allah-Təalanı qoyub günəşə sitayiş etdiyini gördüm.** (وَزَيَّنَ لَهُمُ الشَّيْطَانُ اَعْمَالَهُمْ) **- şeytan** (bu çirkin şirk) **əməllərini onlara gözəl göstərib** (müşrik olublar). (فَصَدَّهُمْ عَنِ السَّبِيلِ فَهُمْ لاَ يَهْتَدُونَ) – (şeytan onları haqq) **yolundan azdırıb, onlar da hidayət yolunu tapa bilmirlər.**

**25)** (اَلَّا يَسْجُدُوا لِلّٰهِ الَّذِي يُخْرِجُ الْخَبْءَ فِي السَّمٰوَاتِ وَالْاَرْضِ) – **səmalarda** (yağışı) **və yerdə** (yağış səbəbinə) **gizlin şeyləri** (bitkiləri) **ortaya çıxaran Allah-Təalaya səcdə etməsinlər deyə** (şeytan onlara mane olubdur). (وَيَعْلَمُ مَا تُخْفُونَ وَمَا تُعْلِنُونَ) – (halbuki) **Allah-Təala gizlətdiyiniz və açıq-aşkar etdiyiniz hər bir şeydən agahdır.**

**26)** (اَللّٰهُ لَٓا اِلٰهَ اِلَّا هُوَ رَبُّ الْعَرْشِ الْعَظِيمِ) – (haqq) **məbud Allah-Təaladır, Ondan başqa** (haqq) **məbud yoxdur, böyük ərşin tərbiyə verən rəbbidir.”** (Hüdhüdun sözü bitdi)

**27)** (قَالَ سَنَنْظُرُ اَصَدَقْتَ اَمْ كُنْتَ مِنَ الْكَاذِبِينَ) – (Süleyman hüdhüda cavab verib) **dedi: “Baxıb görək, doğru deyirsən, yoxsa yalançılardansan?**

**28)** (اِذْهَبْ بِكِتَابِي هٰذَا فَاَلْقِهْ اِلَيْهِمْ) **– get, mənim bu məktubumu aparıb onlara at.** (ثُمَّ تَوَلَّ عَنْهُمْ فَانْظُرْ مَاذَا يَرْجِعُونَ)* **- sonra onlardan bir az geri çəkilib nə deyəcəklərinə bax.”** (Hüdhüd məktubu aparıb bir deşikdən içəri girib məktubu Səba məlikəsi Bəlqisin yatağına atdı. Bəlqis məktubu görüb, oxuyub məzmunundan agah oldu, əyanlarını toplayıb əhvalatı onlara bəyan etdi. Necə ki növbəti ayədə Allah-Təala xəbər verir)**.**

*(*Qeyd: Ola bilər ki, Süleyman, həqiqətən, hüdhüdə məktub aparmağı öyrədib, onu bu işdə işlədib. Amma Allah-Təala özü bu qissəni hüdhüdə isnad edib onu danışdırmaqla Süleymanın əzəmətini və quş dilini bildiyini göstərmək istəyir).*

**29)** (قَالَتْ يَٓا اَيُّهَا الْمَلَؤُا اِنّ۪ٓي اُلْقِيَ اِلَيَّ كِتَابٌ كَرِيمٌ) – (Bəlqis öz qövmünün əyanlarını toplayıb) **dedi: “Ey əyanlar, həqiqətən, mənə çox hörmətli bir məktub göndərildi.** (Yəni gətirəni məlum deyil)**.**

**30-31)** (اِنَّهُ مِنْ سُلَيْمٰنَ) – (o məktub) **Süleymandandır.** (وَاِنَّهُ بِسْمِ اللّٰهِ الرَّحْمٰنِ الرَّح۪يمِ اَلَّا تَعْلُوا عَلَيَّ وَأْتُونِي مُسْلِمِينَ) – (məktubun məzmunu belədir:) **Rəhman və Rəhim**

قَالَتْ يَآ اَيُّهَا الْمَلَؤُا اَفْتُونِي فِي اَمْرِيۚ مَا كُنْتُ قَاطِعَةً اَمْرًا حَتّٰى تَشْهَدُونِ ﴿٣٢﴾ قَالُوا نَحْنُ اُولُوا قُوَّةٍ وَاُولُوا بَأْسٍ شَدِيدٍ وَالْاَمْرُ اِلَيْكِ فَانْظُرِي مَاذَا تَأْمُرِينَ ﴿٣٣﴾ قَالَتْ اِنَّ الْمُلُوكَ اِذَا دَخَلُوا قَرْيَةً اَفْسَدُوهَا وَجَعَلُوٓا اَعِزَّةَ اَهْلِهَآ اَذِلَّةًۚ وَكَذٰلِكَ يَفْعَلُونَ ﴿٣٤﴾ وَاِنِّي مُرْسِلَةٌ اِلَيْهِمْ بِهَدِيَّةٍ فَنَاظِرَةٌ بِمَ يَرْجِعُ الْمُرْسَلُونَ ﴿٣٥﴾ فَلَمَّا جَآءَ سُلَيْمٰنَ قَالَ اَتُمِدُّونَنِ بِمَالٍ فَمَآ اٰتٰينِيَ اللّٰهُ خَيْرٌ مِمَّآ اٰتٰيكُمْۚ بَلْ اَنْتُمْ بِهَدِيَّتِكُمْ تَفْرَحُونَ ﴿٣٦﴾

---

**olan Allah-Təalanın adı ilə** (başlayır)**, mənə qarşı təkəbbürlənməyin və gəlib mənə itaət edin.**

**32)** (قَالَتْ يَٓا اَيُّهَا الْمَلَؤُا اَفْتُونِي فِيٓ اَمْرِي) – (məktubu oxuyandan sonra) **dedi: "Ey əyanlar, bu işdə mənə rəy bildirin.** (مَا كُنْتُ قَاطِعَةً اَمْرًا حَتّٰى تَشْهَدُونِ) **– siz olmadan heç bir iş görən** (hökm verən) **deyiləm."**

**33)** (قَالُوا نَحْنُ اُولُوا قُوَّةٍ وَاُولُوا بَأْسٍ شَدِيدٍ) **- dedilər: "Biz qüvvətli və** (silah işlətməkdə) **şücaət sahibiyik.** (وَالْاَمْرُ اِلَيْكِ فَانْظُرِي مَاذَا تَأْمُرِينَ) **- amma hər bir işdə ixtiyar sənindir, bax gör, nə əmr edirsən,** (biz itaət edərik)**.**

**34)** (قَالَتْ اِنَّ الْمُلُوكَ اِذَا دَخَلُوا قَرْيَةً اَفْسَدُوهَا) **-** (Bəlqis gördü ki, əyanların fikri savaşmaqdır. Özü sülhə meyil edib belə) **dedi:** (padşahlar arasında savaş olanda)**, həqiqətən,** (qalib olan) **padşahlar bir məmləkətə girəndə, oranı xarabalıq edərlər.** (وَجَعَلُوا اَعِزَّةَ اَهْلِهَا اَذِلَّةً) **- onun izzətli şəxslərini də zəlil edib** (bir qismini öldürər, bir qismini əsir edərlər)**.** (وَكَذٰلِكَ يَفْعَلُونَ) – (padşahların adətləri belədir)**, belə hərəkət edərlər.**

**35)** (وَاِنِّي مُرْسِلَةٌ اِلَيْهِمْ بِهَدِيَّةٍ فَنَاظِرَةٌ بِمَ يَرْجِعُ الْمُرْسَلُونَ) **-** (Bəlqis deyir:) **həqiqətən, mən** (Süleymana və onun qövmünə) **hədiyyə göndərəcəyəm. Baxaq görək** (elçilər) **nə** (xəbərlə) **geri gələcəklər,** (o xəbərlərə görə iş görərik)**.** (Bəlqisin bu sözünü əyanlar qəbul etdilər, ondan sonra elçilərə bir qədər ləl-cavahiratlı hədiyyələr verib, Süleymanın səltənətini, güc və qüdrətini öyrənmələrini tövsiyə edib yola saldılar. O şəxslər Süleymanın hüzuruna gedib, hədiyyələri Süleymana təqdim etdilər. Təfsirçilər Süleymanın Cəbrayıl vasitəsilə Bəlqisin göndərdiyi o hədiyyələrdən xəbərdar olub, onlardan ötrü fövqəladə və imkansız olan tədarüklər görməsi haqqında müxtəlif və ağıla zidd sözlər yazıblar. Mən həqir onları yazmaqdan vaz keçdim)**.**

**36)** (فَلَمَّا جَٓاءَ سُلَيْمٰنَ قَالَ اَتُمِدُّونَنِ بِمَالٍ) – (Bəlqis tərəfindən gələn şəxslər) **Süleymanın hüzuruna gəldikdə,** (Süleyman onların gətirdiyi hədiyyələrə baxıb) **dedi: "Siz mənə dünya malı ilə yardım edirsiniz?** (فَمَٓا اٰتٰينِيَ اللّٰهُ خَيْرٌ مِمَّٓا اٰتٰيكُمْ) **- Allah-Təalanın mənə bəxş etdiyi** (haqq din və dünya malı) **sizə verdiyindən yaxşıdır.** (بَلْ اَنْتُمْ بِهَدِيَّتِكُمْ تَفْرَحُونَ) **- bəlkə, siz** (zahiri dünya həyatından başqa, bir şey bilmədiyinizdən bir-birinizə verdiyiniz) **hədiyyələrinizlə sevinirsiniz.**

اِرْجِعْ اِلَيْهِمْ فَلَنَأْتِيَنَّهُمْ بِجُنُودٍ لَا قِبَلَ لَهُمْ بِهَا وَلَنُخْرِجَنَّهُمْ مِنْهَآ اَذِلَّةً وَهُمْ صَاغِرُونَ ﴿٣٧﴾ قَالَ يَآ
اَيُّهَا الْمَلَؤُا اَيُّكُمْ يَأْتِينِي بِعَرْشِهَا قَبْلَ اَنْ يَأْتُونِي مُسْلِمِينَ ﴿٣٨﴾ قَالَ عِفْرِيتٌ مِنَ الْجِنِّ اَنَا اٰتِيكَ بِهِ
قَبْلَ اَنْ تَقُومَ مِنْ مَقَامِكَ وَاِنِّي عَلَيْهِ لَقَوِيٌّ اَمِينٌ ﴿٣٩﴾ قَالَ الَّذِي عِنْدَهُ عِلْمٌ مِنَ الْكِتَابِ اَنَا اٰتِيكَ
بِهِ قَبْلَ اَنْ يَرْتَدَّ اِلَيْكَ طَرْفُكَ

---

(Amma mən belə hədiyyələri qəbul etməyib ona şad olmaram. Ancaq Allah-Təalaya şərik qoşmağı tərk edib tövhidə inanmağınız istisnadır)**.**

**37)** (اِرْجِعْ اِلَيْهِمْ فَلَنَأْتِيَنَّهُمْ بِجُنُودٍ لَا قِبَلَ لَهُمْ بِهَا) – (Süleyman Bəlqisin yanından gələn elçilərin başçısına dedi: Bəlqisin və onun qövmünün yanına) **qayıt,** (əgər iman gətirib Allah-Təalaya itaət etməsələr)**, əlbəttə, onların üstünə elə bir ordu göndərərəm ki, onun müqabilində dura bilməzlər.** (وَلَنُخْرِجَنَّهُمْ مِنْهَا اَذِلَّةً وَهُمْ صَاغِرُونَ) – **onları zəlil və həqir** (əsir və qul) **olduqları halda** (yurdlarından) **çıxardarıq.**

**38)** (قَالَ يَا اَيُّهَا الْمَلَؤُا اَيُّكُمْ يَأْتِينِي بِعَرْشِهَا قَبْلَ اَنْ يَأْتُونِي مُسْلِمِينَ) – (Süleyman Bəlqisin elçisini yola saldı, o da gedib əhvalatı Bəlqisə nəql etdi. Bəlqis özü Süleymanın yanına getmək üçün yola çıxdı. Süleyman öz yanındakı şəxslərə) **dedi: ey əyanlar,** (Bəlqis və adamları) **itaət edib yanıma gəlmədən əvvəl sizdən kim onun taxtını məndən ötrü gətirər?**

**39)** (قَالَ عِفْرِيتٌ مِنَ الْجِنِّ اَنَا اٰتِيكَ بِهِ قَبْلَ اَنْ تَقُومَ مِنْ مَقَامِكَ) **- cinlərdən olan** (qüvvətli) **biri dedi: sən yerindən durmadan** (o taxtı) **səndən ötrü gətirərəm.** (Süleyman hər gün günortaya kimi o məclisdə əyləşib hökm edərdi)**.** (وَاِنِّي عَلَيْهِ لَقَوِيٌّ اَمِينٌ) **- həqiqətən, mən** (o taxtı gətirmək üçün) **qüvvətli və əmin bir şəxsəm.**

**40)** (قَالَ الَّذِي عِنْدَهُ عِلْمٌ مِنَ الْكِتَابِ) **- Kitabdan** (Allah-Təalaya məxsus olan Lövhi-məhfuzdan) **bir qədər elmi olan şəxs dedi:** (اَنَا اٰتِيكَ بِهِ قَبْلَ اَنْ يَرْتَدَّ اِلَيْكَ طَرْفُكَ) **- gözünü açıb yummadan mən** (o taxtı) **sənə gətirərəm.** (Bu sözü deyən kimi taxt hazır oldu, Süleyman taxta baxıb onun hüdhüdün dediyi kimi olduğunu gördü. Taxtı gətirən şəxsin adı haqqında təfsirçilər ixtilaf ediblər, bəziləri deyib ki, o, Süleymanın katibi Asəf Bərxiya oğludur, bəziləri deyib ki, onun adı Ostom idi. Bəziləri də deyib ki, o, Cəbrayıl idi, bəziləri də Süleymanın özü idi, deyiblər. Onun Xızır olduğunu deyənlər də var. Həm bu barədə, həm də taxtın necə gətirilməsi haqda müxtəlif sözlər yazıblar. Bəziləri deyib ki, taxt öz yerində yerə batıb Süleymanın yanında yerdən çıxdı, bəziləri də deyib ki, Allah-Təala orada taxtı yox edib, Süleymanın yanında ortaya çıxardı, bundan başqa da sözlər deyiblər ki, heç birisi qəbul olunan sözlər deyil, çünki bir cismin bir məkandan başqa bir məkana nəql olunması üçün zamana ehtiyac var, bir cismin uzaq bir məkandan bir anda başqa bir məkana nəql olunması imkansızdır. Allah-Təala imkansız olan bir iş görməz. Amma bu mətləb

**فَلَمَّا رَاٰهُ مُسْتَقِرًّا عِنْدَهُ قَالَ هٰذَا مِنْ فَضْلِ رَبّيۚ لِيَبْلُوَنّي ءَاَشْكُرُ اَمْ اَكْفُرُ وَمَنْ شَكَرَ فَاِنَّمَا يَشْكُرُ لِنَفْسِهٖۚ وَمَنْ كَفَرَ فَاِنَّ رَبّي غَنِيٌّ كَرِيمٌ ﴿٤٠﴾ قَالَ نَكِّرُوا لَهَا عَرْشَهَا نَنْظُرْ اَتَهْتَدٖي اَمْ تَكُونُ مِنَ الَّذٖينَ لَا يَهْتَدُونَ ﴿٤١﴾**

---

ayədə açıq-aşkar qeyd olunduğundan ya gərək bunu Allah-Təalanın qüdrətinə həvalə edib, o barədə heç bir söz danışmayaq və ya doğru bir şəkildə yozub, bunun mənasının Süleymanın Bəlqisin taxtına, Səba dövlətinə sahib olması şəklində anlayaq. Süleyman elə bir tədbir görülməsini istədi ki, Bəlqis onun yanına gələndən sonra o tədbirin səbəbinə Bəlqisin məmləkətinə asanlıqla malik olub özünə tabe etsin və bu səbəbdən vəzirləri ilə məşvərət edib dedi: “Ey əyanlar, (Bəlqis və adamları) itaət edib yanıma gəlmədən əvvəl sizdən kim onun taxtını məndən ötrü gətirər?”. Yəni kim onun səltənətini bir tədbirlə mənə həvalə edə bilər? İfrit günortaya kimi vaxt istəsə də, Süleyman onun təklifini qəbul etməyib imtina etdi. Asəf Bərxiya oğlu isə vəzir olub, siyasət elmindən də xəbərdar olduğundan Bəlqisin məmləkətinə hakim olma yolunu Süleymana göstərdi. Yəni Allah-Təalanın Süleymana bəxş etdiyi qüdrəti və Bəlqisdə o cür qüdrətin olmadığını Süleymana bildirdi. Süleyman Asəfin təklifi ilə Bəlqisin səltənətinə sahib ola biləcəyini gördü, bu səbəbdən Allaha şükür edib, ondan sonra əmr etdi ki, Bəlqisin dövlətində olan qanunları dəyişdirib, Bəlqisin ağlına gəlməyən yeni qanunlar tərtib etsinlər ki, Bəlqis gələndə o qanunları görüb öz idarəçilik metodundan vaz keçsin. Bəlqis Süleymanın hüzuruna gəlib, onun səltənət işlərini görəndə çaşqın qaldı. Ona dedilər ki, sənin səltənətin də belədir? Özünü zəlil etmək istəməyib, dedi: sanki mənim səltənətimdir. Ondan sonra Süleymanın dövlətinə fikir verib özünü onun müqabilində aciz hesab etdi. Məmləkətini ona təslim edib özü də Allah-Təalaya iman gətirib Süleymana tabe oldu). **(فَلَمَّا رَاٰهُ مُسْتَقِرًّا عِنْدَهُ)** – (Süleyman Bəlqisin taxtının – hakimiyyətinin) **öz yanında durduğunu gördükdə,** **(قَالَ هٰذَا مِنْ فَضْلِ رَبّي)** – (Allah-Təalaya həmd-səna və şükür edib) **dedi: bu** (ucalıq mənə) **rəbbim Allah-Təalanın lütf və kəramətindəndir,** (yoxsa məndə o ləyaqət yoxdur ki, Allah-Təala mənə bu qədər qüdrət bəxş etsin). **(لِيَبْلُوَنٖي ءَاَشْكُرُ اَمْ اَكْفُرُ)** – (Allah-Təalanın bu lütfünün səbəbi odur ki,) **məni imtahan etsin, görsün** (Allah-Təalanın nemətlərinə) **şükür edirəm, yoxsa nankorluq edib** (qiymətini bilmirəm?) **(وَمَنْ شَكَرَ فَاِنَّمَا يَشْكُرُ لِنَفْسِهٖ)** **- kim** (Allah-Təalaya) **şükür etsə, həqiqətən, o, özü** (öz xeyri) **üçün şükür edibdir.** (Vacib olan borcunu ödəyib, Allah-Təalanın yanında dərəcəsini artırıbdır). **(وَمَنْ كَفَرَ فَاِنَّ رَبّي غَنِيٌّ كَرِيمٌ)** **- və kim** (Allah-Təalanın nemətlərinə) **nankorluq etsə, həqiqətən, mənim rəbbim Allah-Təala** (onun şükür etməsinə) **möhtac deyil, lütf edib** (nankorlara da nemət verər)**.**

**41)** **(قَالَ نَكِّرُوا لَهَا عَرْشَهَا)** – (Süleyman) **əmr etdi ki,** (Bəlqisin) **taxtını** (hakimiyyət qanunlarını) **dəyişdirin.** **(نَنْظُرْ اَتَهْتَدٖي اَمْ تَكُونُ مِنَ الَّذٖينَ لَا يَهْتَدُونَ)** **- baxaq**

فَلَمَّا جَآءَتْ قِيلَ اَهٰكَذَا عَرْشُكِۜ قَالَتْ كَاَنَّهُ هُوَۚ وَاُو۫تِينَا الْعِلْمَ مِنْ قَبْلِهَا وَكُنَّا مُسْلِم۪ينَ ﴿٤٢﴾ وَصَدَّهَا
مَا كَانَتْ تَعْبُدُ مِنْ دُونِ اللّٰهِۜ اِنَّهَا كَانَتْ مِنْ قَوْمٍ كَافِر۪ينَ ﴿٤٣﴾ ق۪يلَ لَهَا ادْخُلِي الصَّرْحَۚ فَلَمَّا رَاَتْهُ
حَسِبَتْهُ لُجَّةً وَكَشَفَتْ عَنْ سَاقَيْهَاۜ قَالَ اِنَّهُ صَرْحٌ مُمَرَّدٌ مِنْ قَوَار۪يرَۜ قَالَتْ رَبِّ اِنّ۪ي ظَلَمْتُ نَفْس۪ي
وَاَسْلَمْتُ مَعَ سُلَيْمٰنَ لِلّٰهِ رَبِّ الْعَالَم۪ينَ ﴿٤٤﴾ وَلَقَدْ اَرْسَلْنَٓا اِلٰى ثَمُودَ اَخَاهُمْ صَالِحًا اَنِ اعْبُدُوا اللّٰهَ

---

**görək** (şirki tərk edib, Allah-Təalaya iman gətirib) **hidayət tapacaq, yoxsa hidayət tapmayanlardan olacaq?**

**42)** (فَلَمَّا جَآءَتْ ق۪يلَ اَهٰكَذَا عَرْشُكِ) **-** (Bəlqis) **gəldikdə** (Süleymanın səltənətini görüb öz səltənəti gözündə düşdü)**, ona dedilər: "Sənin taxtın** (səltənətin) **də belədir?"** (قَالَتْ كَاَنَّهُ هُوَ) **- dedi: "Sanki, odur,** (mənim taxtım, səltənətim kimidir. Özünü zəlil etməməkdən ötrü belə dedi)**.** (وَاُو۫تِينَا الْعِلْمَ مِنْ قَبْلِهَا وَكُنَّا مُسْلِم۪ينَ) **-** (Bəlqis deyir: "Süleymanın bu hallarını görmədən) **əvvəl,** (onun məktubundan və elçilərimizin xəbərindən Süleymanın haqq olduğuna dair) **bizə elm verilib,** (Allah-Təalaya) **itaət edənlərdən olmuşduq."**

**43)** (وَصَدَّهَا مَا كَانَتْ تَعْبُدُ مِنْ دُونِ اللّٰهِ) **-** (ey Məhəmməd)**, bundan əvvəl** (Bəlqisin Allah-Təalaya iman gətirməsinə) **Allah-Təaladan başqasına** (günəşə) **sitayiş etməsi mane oldu.** (اِنَّهَا كَانَتْ مِنْ قَوْمٍ كَافِر۪ينَ) **- həqiqətən,** (Bəlqis) **bundan əvvəl kafir olan camaatdan idi.** (Onların arasında böyüdüyü üçün Allah-Təalaya kafir olub günəşə ibadət edirdi. Amma Süleymanın yanına gəlib, ilahi möcüzələri gördükdə, dərhal iman gətirdi. Süleyman hündür bir qəsr tikdirib, onun həyətinin döşəməsini büllur şüşədən edib, şüşənin altından gölməçə düzəltdirmişdi. Süleyman Bəlqisə o qəsrə daxil olmağı təklif etdi. Necə ki sıradakı ayədə xəbər verir)**.**

**44)** (ق۪يلَ لَهَا ادْخُلِي الصَّرْحَ) – (Süleymanın əmri ilə Bəlqisə) **deyildi: "Qəsrə daxil olun.** (فَلَمَّا رَاَتْهُ حَسِبَتْهُ لُجَّةً وَكَشَفَتْ عَنْ سَاقَيْهَا) – (Bəlqis ora daxil olmaq istədi, döşəməni) **gördükdə, onu dərin gölməçə sandı,** (zənn etdi ki, Süleyman onu o suda qərq etmək istəyir, qayıtmağa da utandı, gölməçəyə girmək üçün ətəyini qaldırıb) **baldırlarını açdı.** (قَالَ اِنَّهُ صَرْحٌ مُمَرَّدٌ مِنْ قَوَار۪يرَ) – (Süleyman tərəfindən vəzifələndirilən şəxs onun qorxduğunu görüb) **dedi:** (qorxma, bu su deyil)**, həqiqətən, o, elə bir qəsrdir ki,** (döşəməsi) **büllurdan düzəldilib.** (Bədgüman olma, daxil ol)**.** (قَالَتْ رَبِّ اِنّ۪ي ظَلَمْتُ نَفْس۪ي) - (Bəlqis) **dedi: "Ey mənim rəbbim,** (Süleymanın haqqında bədgüman olmaqla) **özümə zülm etdim."** (وَاَسْلَمْتُ مَعَ سُلَيْمٰنَ لِلّٰهِ رَبِّ الْعَالَم۪ينَ) **- Süleymanla** (ona tabe olaraq) **aləmlərə tərbiyə verən rəbb Allah-Təalaya itaət edib** (imana daxil oldum. Süleymanın və Bəlqisin qissəsi bitdi)**.**

**45)** (وَلَقَدْ اَرْسَلْنَٓا اِلٰى ثَمُودَ اَخَاهُمْ صَالِحًا اَنِ اعْبُدُوا اللّٰهَ) **-** (ey Məhəmməd)**, həqiqətən, Səmud camaatına onların qardaşı Salehi** (peyğəmbər) **göndərdik.** (Saleh

فَاِذَا هُمْ فَرِيقَانِ يَخْتَصِمُونَ ﴿٤٥﴾ قَالَ يَا قَوْمِ لِمَ تَسْتَعْجِلُونَ بِالسَّيِّئَةِ قَبْلَ الْحَسَنَةِۚ لَوْلَا تَسْتَغْفِرُونَ
اللّٰهَ لَعَلَّكُمْ تُرْحَمُونَ ﴿٤٦﴾ قَالُوا اطَّيَّرْنَا بِكَ وَبِمَنْ مَعَكَۜ قَالَ طَٓائِرُكُمْ عِنْدَ اللّٰهِ بَلْ اَنْتُمْ قَوْمٌ تُفْتَنُونَ
﴿٤٧﴾ وَكَانَ فِي الْمَدٖينَةِ تِسْعَةُ رَهْطٍ يُفْسِدُونَ فِي الْاَرْضِ وَلَا يُصْلِحُونَ ﴿٤٨﴾

---

gedib onlara) **dedi: "Allah-Təalaya ibadət edib** (müvəhhid olun, şirki də tərk edin)**.** (فَاِذَا هُمْ فَرِيقَانِ يَخْتَصِمُونَ) – (Salehin bu sözündən sonra) **onlar dərhal bir-biriləri ilə mübahisə edən iki dəstə oldular,** (bir dəstə Saləhə iman gətirib, qalanları küfr içində qaldı. Saleh onlara dedi: "Gəlin tövbə edib, Allah-Təala-ya dönün, yoxsa sizə əzab nazil olar." Dedilər: "Əzabın gələcəyinə inanmırıq, əzab gəldiyində tövbə edərik. Əgər gəlməsə, öz dinimizdə də qalacağıq. Əgər doğru deyirsənsə, o əzabı tez gətir." Saleh onların bu sözlərinə gələn ayədə deyildiyi kimi cavab verdi)**.**

**46)** (قَالَ يَا قَوْمِ لِمَ تَسْتَعْجِلُونَ بِالسَّيِّئَةِ قَبْلَ الْحَسَنَةِ) – (Saleh) **dedi: "Ey qövmüm, niyə yaxşılıqdan** (tövbədən) **qabaq pisliyi** (əzabı istəyib ona) **tələsirsiniz?** (Bu nə sözdür ki, deyirsiniz? Əzab gələndən sonra tövbə etmək mümkün olmaz)**.** (لَوْلَا تَسْتَغْفِرُونَ اللّٰهَ لَعَلَّكُمْ تُرْحَمُونَ) – **niyə** (əzabdan əvvəl tövbə edib) **Allah-Təaladan bağışlanmaq diləmirsiniz ki, bəlkə, Allah-Təala sizə rəhm edib,** (bağışlasın?)

**47)** (قَالُوا اطَّيَّرْنَا بِكَ وَبِمَنْ مَعَكَ) **-** (onların məmləkətinə neçə vaxtdır yağış yağmadığından) **dedilər: "**(ey Saleh)**, sənin və sənə iman gətirənlərin** (bu yeni dinin*) **ucbatından uğursuzluğa düşdük.** (Siz bu təzə dini gətirəndən sonra bərəkətimiz itib, yağış da yağmır)**."** (قَالَ طَٓائِرُكُمْ عِنْدَ اللّٰهِ) – (Saleh) **dedi: "Sizə gələn** (xeyir və) **şər Allah-Təaladandır.** (Allah-Təala istəsə, sizə yağış göndərib ruzi verər, istəsə, yağışı kəsib ruzi verməz. Məndən sizə bir zərər gəlməz)**.** (بَلْ اَنْتُمْ قَوْمٌ تُفْتَنُونَ) **- bəlkə, siz** (şeytan – xəbis nəfsi-əmmarə tərəfindən içinə) **fitnə düşürülmüş bir camaatsınız,** (bu səbəbdən Allah-Təalanın dinini uğursuz sayırsınız)**."**

*(*Qeyd: Ərəblər bir səfərə gedəndə qarşılarına çıxan quşlarla fala baxardılar. Sağdan sola keçən quşa Sanih deyib, o falı xeyirli sayardılar. Soldan sağa keçən quşa Barih deyib falı bəd sayardılar. Ərəblər hər bir quşa "tayr" dediklərindən fal bəd gələndə "tayr, tair, tatayyur" kəlmələrini, fal xeyir gələndə isə "fal və təfaül" kəlmələrini işlədərdilər. Necə ki Allah-Təala da Salehin hekayəsində onların istilahıyla "tayr" kəlməsini işlədir. Hz. Peyğəmbər buyurubdur: "İslamda falçılıq, falın bəd gəlməsi deyə bir şey yoxdur, fal bəd gəlsə də, işinizə davam edin").*

**48)** (وَكَانَ فِي الْمَدٖينَةِ تِسْعَةُ رَهْطٍ يُفْسِدُونَ فِي الْاَرْضِ وَلَا يُصْلِحُونَ) – (Salehin Hicr adlı) **şəhərində 9 nəfər** (qəbilə başçısı) **var idi, yer üzündə fəsad törədib, islah etməzdilər.** (O 9 qəbilə başçısı Salehin dəvəsini öldürmək üçün birləşdilər, başçıları Qudar ibn Salif idi)**.**

قَالُوا تَقَاسَمُوا بِاللَّهِ لَنُبَيِّتَنَّهُ وَاَهْلَهُ ثُمَّ لَنَقُولَنَّ لِوَلِيِّهِ مَا شَهِدْنَا مَهْلِكَ اَهْلِهِ وَاِنَّا لَصَادِقُونَ ﴿٤٩﴾
وَمَكَرُوا مَكْرًا وَمَكَرْنَا مَكْرًا وَهُمْ لَا يَشْعُرُونَ ﴿٥٠﴾

---

**49)** (قَالُوا تَقَاسَمُوا بِاللَّهِ لَنُبَيِّتَنَّهُ وَاَهْلَهُ) – (o 9 qəbilə başçısı bir yerə toplanıb) **Allah-Təalaya and içib dedilər:** "Gecə vaxtı gedib Salehin özünü və ailəsini** (tərəfdarlarını) **qətlə yetirərik.** (ثُمَّ لَنَقُولَنَّ لِوَلِيِّهِ مَا شَهِدْنَا مَهْلِكَ اَهْلِهِ وَاِنَّا لَصَادِقُونَ) – (onları öldürəndən) **sonra onun** (qan intiqamını almaq istəyən) **qəyyumuna deyərik: biz onun ailəsi öldürüldüyündə orada olmamışıq və həqiqətən, doğru deyənlərdənik."**

*(****Qeyd:** Salehə gecə vaxtı hücum etməyi düşündülər. Çünki gecə vaxtı düşmənə hücum edib, ona zərər yetirmək, bunu gündüz etməkdən asan olur. Bu, xəbis və alçaq şəxslərin əməlidir. Amma saleh şəxslər düşmənini xəbərdar edib ondan sonra ona hücum edərlər, necə ki İsgəndər Zülqərneyndən nəql olunur, bir düşmənin üstünə gedəndə məsləhətçilər şurası tövsiyə etdi ki, gecə ikən hücum edib onları dağıdaq. İsgəndər dedi: "Oğrular kimi gecə vaxtı gedib düşmənə qalib olmaq padşahlara layiq deyil." İsgəndərin bu sözü qəlbin qanıyla göz bəbəyinə yazılsa, buna layiqdır, belə şəxsə nə tərif deyəsən ki, ona layiq olsun? Belə gözəl xüsusiyyətə sahib olduğuna görə, Allah-Təala onu az vaxtda bütün şərqə, qərbə, dünyaya hakim edib, adını əbədiləşdirməkdən ötrü Qurani-Şərifdə Zülqərneyn ləqəbiylə onu yad edib, əhvalatını da müxtəsər zikr edibdir. İkincisi, Salehin qövmü onu qətl etməyə qərar verdi. Lakin yalan danışmağın qəbahətini anlayıb, yalan danışmamaq üçün başqa bir hiylə edib bir-birilərinə dedilər: "Əgər bizdən soruşsalar ki, Saleh və onun ailəsini siz öldürübsünüz? O vaxt da inkar edib desək ki, xəbərimiz yoxdur, yalan demiş olarıq.:Biz həm Salehi, həm onun ailəsini öldürməyə getdiyimiz üçün gəlin belə and içib deyək ki, biz Salehin ailəsi öldürüldüyündə orada olmamışıq. Yəni sadəcə onun ailəsini öldürməyə getməyib, Salehi də öldürdüyümüz üçün, həm məqsədimizə çatar, həm də yalan danışmaqdan çəkinmiş olarıq." Gör bütpərəst müşriklər necə də adam öldürüb, amma yalan danışmağı öldürməkdən böyük günah sayıb ondan çəkinirlər. Amma islam ümməti həm adam öldürüb, həm yalan danışmağı özlərinə adət edib, adlarını müsəlman qoyub axirətdə nicat tapmağa ümid edirlər. Həqiqətən, diqqətlə baxanda yalan danışmaq adam öldürməkdən böyük günahdır. Çünki yalan danışmaq, yalandan şəhadət etmək olmasa, qətlin üstü açılar. Qətlə şahid olanlar həqiqəti etiraf etsələr, qatil öz cəzasına çatıb, digər pis insanlar da qatilliyin cəzasından qorxub belə bir pis işə bulaşmazlar. Salehin qövmü müşrik olsa da, onların insanlığı bizim özünü müsəlman sayan yalançı, pis insanların insanlığından daha yüksək imiş. Allah-Təala bu xüsusiyyətdə olmalarına baxmayaraq bu müşriklərə əzab göndərib həlak etdi. Bəs adlarını müsəlman qoyduğu halda belə yalançı olanları Allah-Təala islam ümmətindən hesab edəcəkmi? Xeyr, onlar bundan uzaqdırlar).*

**50)** (وَمَكَرُوا مَكْرًا) – (Salehin qövmü onu qətlə yetirmək üçün) **məkr, hiylə etdi,** (وَمَكَرْنَا مَكْرًا وَهُمْ لَا يَشْعُرُونَ) **- biz də xəbərləri olmadan** (onların məkrlərinin müqabilində) **məkr edib** (onları həlak etdik)**.**

فَانْظُرْ كَيْفَ كَانَ عَاقِبَةُ مَكْرِهِمْۙ اَنَّا دَمَّرْنَاهُمْ وَقَوْمَهُمْ اَجْمَعِينَ ﴿٥١﴾ فَتِلْكَ بُيُوتُهُمْ خَاوِيَةً بِمَا ظَلَمُواۜ اِنَّ فِي ذٰلِكَ لَاٰيَةً لِقَوْمٍ يَعْلَمُونَ ﴿٥٢﴾ وَاَنْجَيْنَا الَّذِينَ اٰمَنُوا وَكَانُوا يَتَّقُونَ ﴿٥٣﴾ وَلُوطًا اِذْ قَالَ لِقَوْمِهٖٓ اَتَأْتُونَ الْفَاحِشَةَ وَاَنْتُمْ تُبْصِرُونَ ﴿٥٤﴾ اَئِنَّكُمْ لَتَأْتُونَ الرِّجَالَ شَهْوَةً مِنْ دُونِ النِّسَٓاءِۜ بَلْ اَنْتُمْ قَوْمٌ تَجْهَلُونَ ﴿٥٥﴾ فَمَا كَانَ جَوَابَ قَوْمِهٖٓ اِلَّٓا اَنْ قَالُٓوا اَخْرِجُٓوا اٰلَ لُوطٍ مِنْ قَرْيَتِكُمْۚ اِنَّهُمْ اُنَاسٌ يَتَطَهَّرُونَ ﴿٥٦﴾ فَاَنْجَيْنَاهُ وَاَهْلَهُٓ اِلَّا امْرَاَتَهُۘ قَدَّرْنَاهَا مِنَ الْغَابِرِينَ ﴿٥٧﴾

---

**51)** (فَانْظُرْ كَيْفَ كَانَ عَاقِبَةُ مَكْرِهِمْ) - (ey Məhəmməd)**, bax gör ki, onların məkrlərinin aqibəti necə oldu?** (اَنَّا دَمَّرْنَاهُمْ وَقَوْمَهُمْ اَجْمَعِينَ) **- həqiqətən, biz** (o 9 qəbilə başçısını) **və onların camaatının hamısını** (o 9 nəfərin əməlinə razı olduqları üçün) **həlak etdik.**

**52)** (فَتِلْكَ بُيُوتُهُمْ خَاوِيَةً بِمَا ظَلَمُوا) **- budur onların** (Şam yolundakı) **evləri, öz zülmləri səbəbinə xarab olub** (boş qalıbdır. Görəsən, müsəlmanlar həccə gedib-gələndə, o evləri görüb ibrət almırlar?) (اِنَّ فِي ذٰلِكَ لَاٰيَةً لِقَوْمٍ يَعْلَمُونَ) **- həqiqətən, bu** (Salehin qövmünün həlak olub, evlərinin xarab olub boş qalmasında bilən şəxslərdən ötrü bizim tövhid və qüdrətimizə dair) **dəlil və sübutlar vardır.**

**53)** (وَاَنْجَيْنَا الَّذِينَ اٰمَنُوا وَكَانُوا يَتَّقُونَ) – (o əzabdan Salehə) **inanan müttəqi şəxslərə nicat verdik.**

**54)** (وَلُوطًا اِذْ قَالَ لِقَوْمِهٖٓ اَتَأْتُونَ الْفَاحِشَةَ وَاَنْتُمْ تُبْصِرُونَ) – **Lutu da** (Sodom camaatına göndərdik)**, bir zaman öz qövmünə demişdi:** (bəs Allah-Təaladan qorxmadan) **gözünüz görə-görə bir-birinizlə bu çirkin əməli** (homoseksuallıq) **edirsiniz?** (Nə həyasız bir camaatsınız)**.**

**55)** (اَئِنَّكُمْ لَتَأْتُونَ الرِّجَالَ شَهْوَةً مِنْ دُونِ النِّسَاءِ) – **bəs siz arvadları tərk edib** (halbuki qadınlar kişilərdən ötrü yaradılıbdır)**, şəhvətlə kişilərə tərəf gedirsiniz?** (بَلْ اَنْتُمْ قَوْمٌ تَجْهَلُونَ) – **şübhəsiz ki, siz cahil bir qövmsünüz.** (Belə xəbis və cahil əməllər edirsiniz)**.**

**56)** (فَمَا كَانَ جَوَابَ قَوْمِهٖٓ اِلَّٓا اَنْ قَالُٓوا اَخْرِجُوا اٰلَ لُوطٍ مِنْ قَرْيَتِكُمْ) – (Lut qövmü ona cavab verməyib, bir-birilərinə) **dedilər: "Lutun** (özünü və) **ailəsini** (ona tabe olanları) **öz yurdunuzdan çıxarın.** (اِنَّهُمْ اُنَاسٌ يَتَطَهَّرُونَ) – **onlar** (elə şəxslərdir ki,) **özlərini pak hesab edib** (deyirlər: insan belə əməl etməz. Bu sözü istehza ilə dedilər)**.**

**57)** (فَاَنْجَيْنَاهُ وَاَهْلَهُٓ اِلَّا امْرَاَتَهُ قَدَّرْنَاهَا مِنَ الْغَابِرِينَ) – (Lutun özünü) **və ailəsini,** (ona tabe olanları) **xilas etdik, sadəcə arvadının arxada** (o camaatın içində) **qalıb** (həlak olanlardan olmasını) **təqdir etdik.**

وَاَمْطَرْنَا عَلَيْهِمْ مَطَرًاۚ فَسَٓاءَ مَطَرُ الْمُنْذَرِينَ ﴿٥٨﴾ قُلِ الْحَمْدُ لِلّٰهِ وَسَلَامٌ عَلٰى عِبَادِهِ الَّذِينَ اصْطَفٰىۜ
آٰللّٰهُ خَيْرٌ اَمَّا يُشْرِكُونَۜ ﴿٥٩﴾ اَمَّنْ خَلَقَ السَّمٰوَاتِ وَالْاَرْضَ وَاَنْزَلَ لَكُمْ مِنَ السَّمَٓاءِ مَٓاءًۚ فَاَنْبَتْنَا بِه۪
حَدَٓائِقَ ذَاتَ بَهْجَةٍۚ مَا كَانَ لَكُمْ اَنْ تُنْبِتُوا شَجَرَهَاۜ ءَاِلٰهٌ مَعَ اللّٰهِۜ بَلْ هُمْ قَوْمٌ يَعْدِلُونَۜ ﴿٦٠﴾ اَمَّنْ جَعَلَ
الْاَرْضَ قَرَارًا وَجَعَلَ خِلَالَهَٓا اَنْهَارًا وَجَعَلَ لَهَا رَوَاسِيَ وَجَعَلَ بَيْنَ الْبَحْرَيْنِ حَاجِزًاۜ ءَاِلٰهٌ مَعَ اللّٰهِۜ بَلْ
اَكْثَرُهُمْ لَا يَعْلَمُونَۜ ﴿٦١﴾

---

**58)** (وَاَمْطَرْنَا عَلَيْهِمْ مَطَرًا فَسَاءَ مَطَرُ الْمُنْذَرِينَ) – (əzabdan ötrü) **onlara yağış yağdırdıq.** (Allah-Təalanın əzabı ilə) **qorxudulub** (itaət etməyənlərin yağışı) **nə pis yağışdır,** (onlardan ötrü əzab oldu, halbuki yağış bir rəhmətdir. Bundan sonra gələn ayədə Allah-Təala öz peyğəmbəri Hz. Məhəmmədə (ə.s), özünün müqəddəs Zatına həmd-səna edib, öz seçilmiş bəndələrinə salam göndərməyi əmr edir, ondan sonra özünün qüdrət və tövhidinə işarə edən ayələri zikr etməyə başlayır)**.**

**59)** (قُلِ الْحَمْدُ لِلّٰهِ وَسَلَامٌ عَلٰى عِبَادِهِ الَّذِينَ اصْطَفٰى) **-** (ey Məhəmməd)**, de ki, həmdsəna** (yeganə olan müqəddəs) **Allah-Təalaya aiddir,** (Onun pak zatına həmdsəna olsun) **və onun seçilmiş bəndələrinə** (peyğəmbərlərinə, övliyalarına) **salam olsun.** (آٰللّٰهُ خَيْرٌ اَمَّا يُشْرِكُونَ) **-** (ey Məhəmməd, müşriklərə de ki, qüdrət və əzəmət sahibi) **Allah-Təala yaxşıdır, yoxsa** (siz müşriklərin Allah-Təalaya) **şərik qoşduğu** (şeylər?)

**60)** (اَمَّنْ خَلَقَ السَّمٰوَاتِ وَالْاَرْضَ) – (sizin bütlər yaxşıdır)**, yoxsa səmaları və yeri yaradan** (Allah-Təala?) (وَاَنْزَلَ لَكُمْ مِنَ السَّمَٓاءِ مَٓاءً) **- O, sizdən ötrü səmadan su** (yağış) **göndərdi.** (فَاَنْبَتْنَا بِه۪ حَدَٓائِقَ ذَاتَ بَهْجَةٍ) – (o suyun səbəbinə) **gözəl bağlar yetişdiririk.** (مَا كَانَ لَكُمْ اَنْ تُنْبِتُوا شَجَرَهَا) – (hansı ki təkbaşına) **siz** (o bağların) **ağaclarını yetişdirə bilməzdiniz,** (ءَاِلٰهٌ مَعَ اللّٰهِ) – (belə qüdrətli) **Allah-Təala ilə yanaşı başqa tanrılar var** (ki, ona inanıb şərik qoşursunuz?) (بَلْ هُمْ قَوْمٌ يَعْدِلُونَ) – (ey Məhəmməd, bəlkə də müşriklər küfr və inadlarından Allah-Təalaya şərik qoşan, haqq yoldan) **azan bir qövmdürlər.**

**61)** (اَمَّنْ جَعَلَ الْاَرْضَ قَرَارًا) – (sizin bütlər yaxşıdır)**, yoxsa yeri** (sizdən ötrü) **məskən yaradan** (Allah-Təala?) (وَجَعَلَ خِلَالَهَٓا اَنْهَارًا) – (sizdən ötrü yerin) **içində çaylar yaratdı** (ki, o çayların səbəbinə əkin-biçin edib dolanasınız)**.** (وَجَعَلَ لَهَا رَوَاسِيَ) **- və** (o yerdə uca və) **möhkəm dağlar yaratdı** (ki, o dağlardan mənfəət əldə edəsiniz)**.** (وَجَعَلَ بَيْنَ الْبَحْرَيْنِ حَاجِزًا) **- iki dəniz** (şirin və şor) **arasında maneə qoydu** (ki, bir-birilərinə qarışıb məhv olmasınlar. Əgər şirin su şor suya qarışıb məhv olsaydı, insanların yaşaması mümkün olmazdı)**.** (ءَاِلٰهٌ مَعَ اللّٰهِ بَلْ اَكْثَرُهُمْ لَا يَعْلَمُونَ) – (ey Məhəmməd, belə qüdrət sahibi) **Allah-Təala ilə yanaşı başqa tanrı var** (ki, ona inanıb şərik qoşurlar?) **Bəlkə də onların əksəriyyəti**

اَمَّنْ يُجيبُ الْمُضْطَرَّ اِذَا دَعَاهُ وَيَكْشِفُ السُّوٓءَ وَيَجْعَلُكُمْ خُلَفَآءَ الْاَرْضِۜ ءَاِلٰهٌ مَعَ اللّٰهِۜ قَليلًا مَا
تَذَكَّرُونَۜ ﴿٦٢﴾ اَمَّنْ يَهْديكُمْ في ظُلُمَاتِ الْبَرِّ وَالْبَحْرِ وَمَنْ يُرْسِلُ الرِّيَاحَ بُشْرًا بَيْنَ يَدَيْ رَحْمَتِه۪ۜ
ءَاِلٰهٌ مَعَ اللّٰهِۜ تَعَالَى اللّٰهُ عَمَّا يُشْرِكُونَۜ ﴿٦٣﴾ اَمَّنْ يَبْدَؤُا الْخَلْقَ ثُمَّ يُعيدُهُ وَمَنْ يَرْزُقُكُمْ مِنَ السَّمَآءِ
وَالْاَرْضِۜ ءَاِلٰهٌ مَعَ اللّٰهِۜ قُلْ هَاتُوا بُرْهَانَكُمْ اِنْ كُنْتُمْ صَادِقينَ ﴿٦٤﴾ قُلْ لَا يَعْلَمُ مَنْ فِي السَّمٰوَاتِ
وَالْاَرْضِ الْغَيْبَ اِلَّا اللّٰهُۜ

---

(Allah-Təalanın qüdrət və tövhidinə) **agah olmadıqlarından** (Allah-Təalaya şərik qoşurlar)**.**

**62)** (اَمَّنْ يُجِيبُ الْمُضْطَرَّ اِذَا دَعَاهُ) **- sizin bütlər yaxşıdır, yoxsa** (müsibətə düçar olub) **naçar qalan biri Ona dua etdiyi zaman, duasını qəbul edib** (yardım edən Allah-Təala?) (وَيَكْشِفُ السُّوءَ) **- bəla və müsibəti sovuşdurub götürən,** (xəstəliyi sağlamlıqla, yoxsulluğu zənginliklə əvəz edən Allah-Təala yaxşıdır, yoxsa bütlər?) (وَيَجْعَلُكُمْ خُلَفَاءَ الْاَرْضِ) **- və sizi yer üzündə xəlifə** (və hakim) **edib,** (hər şeyi ixtiyarınıza verən Allah-Təala yaxşıdır, yoxsa bütlər?) (ءَاِلٰهٌ مَعَ اللّٰهِ قَلِيلًا مَا تَذَكَّرُونَ) – (ey Məhəmməd, belə qüdrət sahibi) **Allah-Təala ilə yanaşı ayrı tanrı var ki,** (ona inanıb şərik qoşursunuz?) **Sizdən çox az kimsələr düşünüb** (şərik qoşmur)**.**

**63)** (اَمَّنْ يَهْدِيكُمْ فِي ظُلُمَاتِ الْبَرِّ وَالْبَحْرِ) – (sizin bütlər yaxşıdır)**, yoxsa çölün və dənizin qaranlıqlarında** (sizdən ötrü ulduzlar və s. yaradıb onlarla) **sizə doğru yolu göstərən** (Allah-Təala?) (وَمَنْ يُرْسِلُ الرِّيَاحَ بُشْرًا بَيْنَ يَدَيْ رَحْمَتِهِ) **- və** (o Allah-Təala ki,) **öz rəhmətinin** (yağışın) **qabağınca müjdə verən küləklər göndərir** (ki, yağışın gəlməsini sizə xəbər versin)**.** (ءَاِلٰهٌ مَعَ اللّٰهِ تَعَالَى اللّٰهُ عَمَّا يُشْرِكُونَ) – (belə qüdrət sahibi) **Allah-Təala ilə  yanaşı ayrı tanrı var** (ki, ona şərik qoşurlar?) **Allah-Təala ona şərik qoşulan şeylərdən ucadır.** (Hər şey onun məxluqudur. Məxluqun xaliqinə şərik olması imkansızdır)**.**

**64)** (اَمَّنْ يَبْدَؤُا الْخَلْقَ ثُمَّ يُعِيدُهُ) – (sizin bütlər yaxşıdır)**, yoxsa məxluqu öncə yaradıb** (öldükdən) **sonra** (qiyamət günündə haqq-hesabdan ötrü) **onu yenidən yaradan** (Allah-Təala?) (وَمَنْ يَرْزُقُكُمْ مِنَ السَّمَاءِ وَالْاَرْضِ) **– və** (o Allah-Təala ki,) **sizə səmadan** (yağış) **və yerdən ruzi** (bitki və meyvələr) **verir.** (ki, onlarla dolanasınız. Sizin bütlər belə Allah-Təaladan yaxşıdırmı?) (ءَاِلٰهٌ مَعَ اللّٰهِ) **–** (belə qüdrət sahibi) **Allah-Təala ilə yanaşı ayrı tanrı var** (ki, ona şərik qoşursunuz?) (قُلْ هَاتُوا بُرْهَانَكُمْ اِنْ كُنْتُمْ صَادِقِينَ) **-** (ey Məhəmməd, müşriklərə) **de ki, əgər** (Allah-Təalanın şəriki var – sözünüzdə) **doğrusunuzsa, dəlilinizi gətirib** (isbat edin. Çünki dəlili olmayan söz batildir)**.**

**65)** (قُلْ لَا يَعْلَمُ مَنْ فِي السَّمٰوَاتِ وَالْاَرْضِ الْغَيْبَ اِلَّا اللّٰهُ) **-** (ey Məhəmməd, müşriklərə) **de ki, Allah-Təaladan başqa, heç kim səmalarda və yerdəki qeybi bilməz,**

وَمَا يَشْعُرُونَ اَيَّانَ يُبْعَثُونَ ﴿٦٥﴾ بَلِ ادَّارَكَ عِلْمُهُمْ فِي الْاٰخِرَةِ بَلْ هُمْ فِي شَكٍّ مِنْهَا بَلْ هُمْ مِنْهَا
عَمُونَ ﴿٦٦﴾ وَقَالَ الَّذِينَ كَفَرُوا ءَاِذَا كُنَّا تُرَابًا وَاٰبَاؤُنَا اَئِنَّا لَمُخْرَجُونَ ﴿٦٧﴾ لَقَدْ وُعِدْنَا هٰذَا نَحْنُ
وَاٰبَاؤُنَا مِنْ قَبْلُ اِنْ هٰذَا اِلَّا اَسَاطِيرُ الْاَوَّلِينَ ﴿٦٨﴾ قُلْ سِيرُوا فِي الْاَرْضِ فَانْظُرُوا كَيْفَ كَانَ عَاقِبَةُ
الْمُجْرِمِينَ ﴿٦٩﴾ وَلَا تَحْزَنْ عَلَيْهِمْ وَلَا تَكُنْ فِي ضَيْقٍ مِمَّا يَمْكُرُونَ ﴿٧٠﴾ وَيَقُولُونَ مَتٰى هٰذَا
الْوَعْدُ اِنْ كُنْتُمْ صَادِقِينَ ﴿٧١﴾ قُلْ عَسٰى اَنْ يَكُونَ رَدِفَ لَكُمْ بَعْضُ الَّذِي تَسْتَعْجِلُونَ ﴿٧٢﴾

---

(وَمَا يَشْعُرُونَ اَيَّانَ يُبْعَثُونَ) – (qiyamət günü də qeyb xəbərlərindəndir. Onu da ancaq Allah-Təala bilir,) **onlar nə vaxt dirildiləcəklərini bilməzlər.**

**66)** (بَلِ ادَّارَكَ عِلْمُهُمْ فِي الْاٰخِرَةِ) **- lakin** (müşriklərin) **axirət haqqındakı elmi artırılıbdır,** (əgər düşünsələr, axirətə inanarlar). (بَلْ هُمْ فِي شَكٍّ مِنْهَا) **- amma onlar** (axirət) **haqqında şəkk-şübhə içindədirlər.** (بَلْ هُمْ مِنْهَا عَمُونَ) **- bəlkə də** (bəsirət) **gözləri kor olub** (bu səbəbdən onun həqiqətini dərk edə bilməyəcəklər).

**67)** (وَقَالَ الَّذِينَ كَفَرُوا ءَاِذَا كُنَّا تُرَابًا وَاٰبَاؤُنَا اَئِنَّا لَمُخْرَجُونَ) **- kafir** (və müşriklər) **dedilər: "Biz özümüz və ata-babalarımız** (qəbirdə çürüyüb) **torpaq olandan sonra bir də** (qiyamət günü haqq-hesabdan ötrü) **dirilib oradan çıxarılacağıq?**

**68)** (لَقَدْ وُعِدْنَا هٰذَا نَحْنُ وَاٰبَاؤُنَا مِنْ قَبْلُ) **- həqiqətən, bu** (dirilmə) **bizə və əvvəlki ata-babalarımıza da vəd edilibdir.** (اِنْ هٰذَا اِلَّا اَسَاطِيرُ الْاَوَّلِينَ) – **bu** (söz) **ancaq əvvəlkilərin əsatiri,** (yalan sözlərindən) **başqa bir şey deyil,** (Məhəmməd də o yalan sözləri bizə deyir).

**69)** (قُلْ سِيرُوا فِي الْاَرْضِ) - (ey Məhəmməd, müşriklərə) **de ki, yer üzündə** (sizin kimi qiyaməti təkzib edən Ad, Səmud qövmlərinin yurdlarını) **gəzib dolanın,** (فَانْظُرُوا كَيْفَ كَانَ عَاقِبَةُ الْمُجْرِمِينَ) **- baxın görün, o** (asi, kafir, müşrik) **günahkarların aqibəti necə oldu?** (Hamısı əzabla həlak olub, heç biri də sağ qalmadı).

**70)** (وَلَا تَحْزَنْ عَلَيْهِمْ وَلَا تَكُنْ فِي ضَيْقٍ مِمَّا يَمْكُرُونَ) - (ey Məhəmməd, Məkkəli Qüreyş camaatının sənə tabe olmayıb iman etməməsindən) **məhzun və qəmgin olma,** (onlar iman gətirən deyil) **və** (səni qətlə yetirmək üçün) **etdikləri məkr və hiylələrindən də** (qəlbən) **sıxılma.** (Biz özümüz səni onların məkr və hiyləsindən xilas və mühafizə edəcəyik).

**71)** (وَيَقُولُونَ مَتٰى هٰذَا الْوَعْدُ اِنْ كُنْتُمْ صَادِقِينَ) – (müşriklər Hz. Peyğəmbərə və möminlərə) **deyirlər: "Əgər doğru deyirsinizsə, bu vəd** (etdiyiniz əzab) **nə vaxtdır?"**

**72)** (قُلْ* عَسٰى اَنْ يَكُونَ رَدِفَ لَكُمْ بَعْضُ الَّذِي تَسْتَعْجِلُونَ) - (ey Məhəmməd, müşriklərə) **de ki, o tələsik istədiyiniz** (əzabın) **bir qismi tezliklə onlara çatacaq,**

**وَاِنَّ رَبَّكَ لَذُو فَضْلٍ عَلَى النَّاسِ وَلٰكِنَّ اَكْثَرَهُمْ لَا يَشْكُرُونَ ﴿٧٣﴾ وَاِنَّ رَبَّكَ لَيَعْلَمُ مَا تُكِنُّ صُدُورُهُمْ وَمَا يُعْلِنُونَ ﴿٧٤﴾ وَمَا مِنْ غَائِبَةٍ فِي السَّمَاءِ وَالْاَرْضِ اِلَّا فِي كِتَابٍ مُبِينٍ ﴿٧٥﴾ اِنَّ هٰذَا الْقُرْاٰنَ يَقُصُّ عَلٰى بَنِي اِسْرَاءِيلَ اَكْثَرَ الَّذِي هُمْ فِيهِ يَخْتَلِفُونَ ﴿٧٦﴾ وَاِنَّهُ لَهُدًى وَرَحْمَةٌ لِلْمُؤْمِنِينَ ﴿٧٧﴾ اِنَّ رَبَّكَ يَقْضِي بَيْنَهُمْ بِحُكْمِهِ وَهُوَ الْعَزِيزُ الْعَلِيمُ ﴿٧٨﴾**

---

(Allah-Təalanın bu vədi doğru olub Bədir savaşında bu ayədə zikr olunan əzaba düçar oldular. Bəzisi öldürülüb, bəzisi də əsir edildi)**.**

*(*Qeyd: "عسي / `asə, لعل /lə`əlla, سوف /savfə"- kəlmələri padşahlar tərəfindən işlədildikdə o sözün doğruluğuna və mütləq vaqe olacağına işarə edər. Padşahların bu kəlmələri işlətməkdə məqsədləri intiqam almaqda tələsməyib, təmkin və vüqarlarını izhar etmək üçündür. Həm də düşmənlərini unutmayıb, istədikləri zaman intiqam almağa qadir olduqlarına işarədir. Allah-Təala da padşahların adəti üzrə söz deyib, Qurani-Şərifində peyğəmbərinə bildirir).*

**73)** (وَاِنَّ رَبَّكَ لَذُو فَضْلٍ عَلَى النَّاسِ) **-** (ey Məhəmməd)**, həqiqətən, sənin rəbbin Allah-Təala insanlara** (Qüreyşə) **qarşı lütf və kəramət sahibidir,** (onların əzabını təxirə salar), (وَلٰكِنَّ اَكْثَرَهُمْ لَا يَشْكُرُونَ) **- lakin** (insanların) **əksəriyyəti** (Allah-Təalaya) **şükür etməyib** (cəhalətlərindən tez-tələsik əzab istəyirlər)**.**

**74)** (وَاِنَّ رَبَّكَ لَيَعْلَمُ مَا تُكِنُّ صُدُورُهُمْ وَمَا يُعْلِنُونَ) **-** (ey Məhəmməd)**, həqiqətən, sənin rəbbin Allah-Təala** (müşriklərin sənə qarşı) **qəlblərində gizlətdikləri və aşkar etdikləri** (kindən) **agahdır.**

**75)** (وَمَا مِنْ غَائِبَةٍ فِي السَّمَاءِ وَالْاَرْضِ اِلَّا فِي كِتَابٍ مُبِينٍ) **-** (ey Məhəmməd)**, səmada və yerdə elə bir** (gizlin və) **qaib şey yoxdur ki,** (Allah-Təalanın elmində) **açıq-aşkar kitabında qeyd olunmasın.**

**76)** (اِنَّ هٰذَا الْقُرْاٰنَ يَقُصُّ عَلٰى بَنِي اِسْرَاءِيلَ اَكْثَرَ الَّذِي هُمْ فِيهِ يَخْتَلِفُونَ) **– həqiqətən, bu Quran bəni-İsrailin öz aralarında ixtilaf etdiyi** (dini məsələlərin) **çoxunu onlara bəyan edir,** (gərək, bəni-İsrail Quranın ehkamına itaət etsin ki, aralarındakı ixtilaf götürülsün)**.**

**77)** (وَاِنَّهُ لَهُدًى وَرَحْمَةٌ لِلْمُؤْمِنِينَ) **- həqiqətən,** (Qurani-Şərif) **ona iman gətirənlərdən ötrü** (haqq yolunu göstərən) **bir hidayət və rəhmətdir.**

**78)** (اِنَّ رَبَّكَ يَقْضِي بَيْنَهُمْ بِحُكْمِهِ وَهُوَ الْعَزِيزُ الْعَلِيمُ) **-** (ey Məhəmməd)**, həqiqətən, sənin rəbbin Allah-Təala** (Qurana iman gətirib-gətirməyənlərin) **arasında hökm edər.** (Allah-Təala kafir və müşriklərə) **qalib** (olub onlardan intiqam alandır. Onların arasında necə hökm edəcəyini) **bilir,** (onun hökmündə heç kimə zülm olunmaz)**.**

فَتَوَكَّلْ عَلَى اللّٰهِ اِنَّكَ عَلَى الْحَقِّ الْمُبِينِ ﴿٧٩﴾ اِنَّكَ لَا تُسْمِعُ الْمَوْتٰى وَلَا تُسْمِعُ الصُّمَّ الدُّعَآءَ
اِذَا وَلَّوْا مُدْبِرِينَ ﴿٨٠﴾ وَمَآ اَنْتَ بِهَادِي الْعُمْيِ عَنْ ضَلَالَتِهِمْ اِنْ تُسْمِعُ اِلَّا مَنْ يُؤْمِنُ بِاٰيَاتِنَا فَهُمْ
مُسْلِمُونَ ﴿٨١﴾ وَاِذَا وَقَعَ الْقَوْلُ عَلَيْهِمْ اَخْرَجْنَا لَهُمْ دَآبَّةً مِنَ الْاَرْضِ

---

**79)** (فَتَوَكَّلْ عَلَى اللّٰهِ اِنَّكَ عَلَى الْحَقِّ الْمُبِينِ) - (ey Məhəmməd,) **Allah-Təalaya təvəkkül edib** (təbliğ işində möhkəm ol)**. Həqiqətən, sən açıq-aşkar olan haqq** (yolu) **üzərindəsən.** (Sənə tabe olmayanlar zəlalətdədirlər)**.**

**80)** (اِنَّكَ لَا تُسْمِعُ الْمَوْتٰى) **-** (ey Məhəmməd,) **həqiqətən, sən** (qəlbləri) **ölü olan** (müşriklərə haqq sözləri) **eşitdirə bilməzsən.** (وَلَا تُسْمِعُ الصُّمَّ الدُّعَآءَ اِذَا وَلَّوْا مُدْبِرِينَ) **- və** (səndən) **üz döndərib gedən,** (qulaqdan) **kar** (olan və uca səslə çağırıldıqda da eşitməyən müşriklərə haqq sözü) **eşitdirə bilməzsən,** (onları özlərinə həvalə edib məhzun olma)**.**

**81)** (وَمَآ اَنْتَ بِهَادِي الْعُمْيِ عَنْ ضَلَالَتِهِمْ) – (ey Məhəmməd, gözləri) **kor** (olub haqq yolundan azıb) **zəlalətdə olan** (müşriklərə də) **hidayət edib** (haqq yoluna götürə) **bilməzsən, ancaq Allah-Təala onları zorla imana daxil edə bilər).** (اِنْ تُسْمِعُ اِلَّا مَنْ يُؤْمِنُ بِاٰيَاتِنَا فَهُمْ مُسْلِمُونَ) **-** (ey Məhəmməd)**, bizə** (ixlasla) **itaət etdiyi halda ayə və möcüzələrimizə iman gətirəndən başqasına sən** (haqq sözü) **eşitdirə bilməzsən.**

**82)** (وَاِذَا وَقَعَ الْقَوْلُ عَلَيْهِمْ اَخْرَجْنَا لَهُمْ دَآبَّةً* مِنَ الْاَرْضِ) **-** (ey Məhəmməd, Allah-Təalanın qiyamət günü haqqında insanlara verdiyi) **söz** (doğru olub qiyamət) **vaqe olduqda,** (onların özünü yerdən çıxarıb həyat verdiyimiz kimi) **yerdən hərəkət edən bir canlı çıxararıq.**

*(*Qeyd: Bu ayədə vaqe olan "dabbə" sözünün mənasında təfsirçilər müxtəlif, mənasız, əsli olmayan şeylər yazıblar. Onları zikr etmək insanı təəccübləndirməkdən başqa bir şeyə yaramaz. Bu səbəbdən onları bir kənara qoyub, zikr etməyə layiq görmədik. Öz aciz araşdırmamızı müxtəsər şəkildə zikr etməyi kafi hesab etdik. "Dabbə" - ərəb dilində yer üzündə hərəkət edən məxluqa, insan və ya qeyri-insana deyilir. Ayədən anlaşılan budur ki, Allah-Təala qiyamət günündə dünyada insanlara göndərdiyi dəlil və peyğəmbərlərdən başqa yerdən yaradılmış insan kimi bir canlı da yaradıb insanların arasına göndərər. Belə ki, Allah-Təala tərəfindən ayənin məzmununu onlara bildirsin və bu sayədə qiyamət gününü inkar edən şəxslər Allah-Təalanın rəhmətindən ümidlərini kəssinlər. Hərçənd bu ayədə yerdən çıxarılacaq bu dəlilin insan, ya da qeyri-insan olması məlum deyil. Amma qanuna görə, gərək, insan olsun, çünki yerdən çıxan məxluq mələk (ruhani güc) ola bilməz. Heyvanın da insana vaiz və dəlil olması məntiqsizdir, bu dünyada insanlara özlərindən olan bir dəlil gəldiyi kimi qiyamət günündə yerdən yaradılacaq o dəlil də, gərək insan olsun. Fərqi budur ki, bu dəlil sırf qiyamət gününə məxsus dəlil olacaq. O, zikr olunan kəlamı məhşər əhlinə çatdırıb, qiyamət gününü inkar edənləri fövqəladə heyrət və peşmanlı-*

تُكَلِّمُهُمْۙ اَنَّ النَّاسَ كَانُوا بِاٰيَاتِنَا لَا يُوقِنُونَ ﴿٨٢﴾ وَيَوْمَ نَحْشُرُ مِنْ كُلِّ اُمَّةٍ فَوْجًا مِمَّنْ يُكَذِّبُ بِاٰيَاتِنَا فَهُمْ يُوزَعُونَ ﴿٨٣﴾ حَتّٰٓى اِذَا جَٓاؤُ قَالَ اَكَذَّبْتُمْ بِاٰيَاتِي وَلَمْ تُحِيطُوا بِهَا عِلْمًا اَمَّاذَا كُنْتُمْ تَعْمَلُونَ ﴿٨٤﴾ وَوَقَعَ الْقَوْلُ عَلَيْهِمْ بِمَا ظَلَمُوا فَهُمْ لَا يَنْطِقُونَ ﴿٨٥﴾ اَلَمْ يَرَوْا اَنَّا جَعَلْنَا الَّيْلَ لِيَسْكُنُوا فِيهِ وَالنَّهَارَ مُبْصِرًاۜ اِنَّ فِي ذٰلِكَ لَاٰيَاتٍ لِقَوْمٍ يُؤْمِنُونَ ﴿٨٦﴾ وَيَوْمَ يُنْفَخُ فِي الصُّورِ فَفَزِعَ مَنْ فِي السَّمٰوَاتِ وَمَنْ فِي الْاَرْضِ اِلَّا مَنْ شَٓاءَ اللّٰهُۜ

---

*ğa salmaqdan başqa, bir şey deməyib susacaq. Kim "dabbə" sözü haqqında yazılan şeylərə agah olmaq istəsə, təfsir kitablarına baxsın. O kitablarda elə sözlər tapacaq ki, onlara baxmaqdan qəlbi sıxılacaq).*

(تُكَلِّمُهُمْ اَنَّ النَّاسَ كَانُوا بِاٰيَاتِنَا لَا يُوقِنُونَ) – (o canlı bizim tərəfimizdən məhşər əhliylə) **danışıb onlara** (Allah-Təalanın adından) **deyər: "Həqiqətən, insanlar** (peyğəmbərlərimizin vasitəsilə gələn) **ayə və möcüzələrə inanmayıb** (bugünkü günü inkar edirdilər. İndi necə oldu, onlara vəd edilən gün gəldi, yoxsa yox?)

**83)** (وَيَوْمَ نَحْشُرُ مِنْ كُلِّ اُمَّةٍ فَوْجًا مِمَّنْ يُكَذِّبُ بِاٰيَاتِنَا فَهُمْ يُوزَعُونَ) – (qiyamət günü elə) **bir gündür ki, hər bir ümmətdən bizim ayələrimizi təkzib edən şəxsləri dəstə-dəstə yığıb** (bir yerə cəm edib məhşərə) **sövq edərik."**

**84)** (حَتّٰى اِذَا جَٓاؤُ) – (qiyamət gününü təkzib edənlər cəm olub) **gəldikdə,** (قَالَ اَكَذَّبْتُمْ بِاٰيَاتِي وَلَمْ تُحِيطُوا بِهَا عِلْمًا) – (Allah-Təala onlara xitab edib) **deyər: "Siz** (dünyada) **mənim ayə və ehkamlarımı düşünüb anlamadan təkzib etdiniz?** (اَمَّاذَا كُنْتُمْ تَعْمَلُونَ) – (bir halda ki, bunu düşünmədiniz)**, bəs nə edirdiniz?** (Axı, əbəs yerə yaradılmayıbsınız)**.**

**85)** (وَوَقَعَ الْقَوْلُ عَلَيْهِمْ بِمَا ظَلَمُوا فَهُمْ لَا يَنْطِقُونَ) – (qiyaməti inkar edənlərin) **öz zülmlərinə görə,** (Allah-Təalanın vəd etdiyi o əzab) **söz vaqe olub** (onları yaxalayar, əzabın təsirindən) **danışıb** (üzr istəməyə də taqətləri olmaz)**.**

**86)** (اَلَمْ يَرَوْا اَنَّا جَعَلْنَا الَّيْلَ لِيَسْكُنُوا فِيهِ) – **bəs** (müşriklər) **görmürlər ki, həqiqətən, biz** (qüdrətimizə dəlil olsun deyə) **gecəni onların istirahəti üçün yaratmışıq,** (gecə bir saat yatmağın insana faydası gündüz yatmaqdan çoxdur, hətta gündüz yatmağın zərərləri də var)**,** (وَالنَّهَارَ مُبْصِرًا) **- və gündüzü işıqlı etdik** (ki, işləyib dolansınlar və nəyin pis-yaxşı olduğunu görüb dərk etsinlər)**.** (اِنَّ فِي ذٰلِكَ لَاٰيَاتٍ لِقَوْمٍ يُؤْمِنُونَ) **- həqiqətən, bu** (gecə-gündüzün var olmasında Allah-Təalanın tövhid və qüdrətinə dair) **iman gətirən bir qövmdən ötrü dəlil və sübutlar var.**

**87)** (وَيَوْمَ يُنْفَخُ فِي الصُّورِ) **- o gün ki,** (qiyamət günü) **surətlərə ruh üflənib** (həyat tapar)**,** (فَفَزِعَ مَنْ فِي السَّمٰوَاتِ وَمَنْ فِي الْاَرْضِ اِلَّا مَنْ شَٓاءَ اللّٰهُ) – **Allah-Təalanın istədikləri istisna, səmalarda və yerdə olan** (məxluqat) **şiddətlə qorxuya**

وَكُلٌّ اَتَوْهُ دَاخِرِينَ ﴿٨٧﴾ وَتَرَى الْجِبَالَ تَحْسَبُهَا جَامِدَةً وَهِيَ تَمُرُّ مَرَّ السَّحَابِ صُنْعَ اللّٰهِ الَّذِي اَتْقَنَ
كُلَّ شَيْءٍ اِنَّهُ خَبِيرٌ بِمَا تَفْعَلُونَ ﴿٨٨﴾ مَنْ جَاءَ بِالْحَسَنَةِ فَلَهُ خَيْرٌ مِنْهَا وَهُمْ مِنْ فَزَعٍ يَوْمَئِذٍ اٰمِنُونَ
﴿٨٩﴾ وَمَنْ جَاءَ بِالسَّيِّئَةِ فَكُبَّتْ وُجُوهُهُمْ فِي النَّارِ هَلْ تُجْزَوْنَ اِلَّا مَا كُنْتُمْ تَعْمَلُونَ ﴿٩٠﴾ اِنَّمَا
اُمِرْتُ اَنْ اَعْبُدَ رَبَّ هٰذِهِ الْبَلْدَةِ الَّذِي حَرَّمَهَا وَلَهُ كُلُّ شَيْءٍ وَاُمِرْتُ اَنْ اَكُونَ مِنَ الْمُسْلِمِينَ ﴿٩١﴾

---

**düşər,** (وَكُلٌّ اَتَوْهُ دَاخِرِينَ) **- hamısı zəlil olduqları halda** (məhşərdə Allah-Təalanın) **hüzuruna gələrlər.**

**88)** (وَتَرَى الْجِبَالَ تَحْسَبُهَا جَامِدَةً) **-** (ey Məhəmməd)**, bu dağlara baxanda sən onları* sabit** (hərəkətsiz) **zənn edirsən,** (وَهِيَ تَمُرُّ مَرَّ السَّحَابِ) **- halbuki** (o dağlar sabit deyil)**, buludlar kimi onlar da hərəkət edir.**

*(*Qeyd: Keçmiş təfsirçilər yerin sabit və hərəkətsiz olub, səyyarələrin hərəkət etdiyinə inandıqlarından bu ayənin mənasını qiyamət gününə məxsus ediblər, amma müasir astronomlar yerin də hərəkət etdiyinə inanırlar. Ayə yerin hərəkətinə açıq-aşkar işarə edir. Xüsusən, ayənin axırına diqqət edilməsi tövsiyə olunur).*

(صُنْعَ اللّٰهِ الَّذِي اَتْقَنَ كُلَّ شَيْءٍ) **- Allah-Təalanın** (bu qəribə) **sənətini** (düşün ki,) **hər bir şeyi necə sağlam yaradıbdır.** (اِنَّهُ خَبِيرٌ بِمَا تَفْعَلُونَ) **- həqiqətən,** (Allah-Təala) **etdiyiniz hər bir şeydən xəbərdardır.**

**89)** (مَنْ جَاءَ بِالْحَسَنَةِ فَلَهُ خَيْرٌ مِنْهَا) **– hər kim** (qiyamət günündə Allah-Təalanın hüzuruna) **xeyir bir əməllə gəlsə, o şəxsdən ötrü** (Allah-Təala yanında ondan da) **yaxşı əcr və savab vardır.** (وَهُمْ مِنْ فَزَعٍ يَوْمَئِذٍ اٰمِنُونَ) **–** (bu xeyir əməl sahibləri qiyamət) **günündə qorxudan əmin olarlar.**

**90)** (وَمَنْ جَاءَ بِالسَّيِّئَةِ فَكُبَّتْ وُجُوهُهُمْ فِي النَّارِ) **- və hər kim** (qiyamət günündə Allah-Təalanın hüzuruna) **pis bir** (günah) **əməllə gəlsə, üzüüstə cəhənnəm oduna atılar.** (هَلْ تُجْزَوْنَ اِلَّا مَا كُنْتُمْ تَعْمَلُونَ) **–** (günahkarlar cəhənnəmə atılanda onlara deyilər:) **sizə ancaq öz əməllərinizin cəzası verilir.**

**91)** (اِنَّمَا اُمِرْتُ اَنْ اَعْبُدَ رَبَّ هٰذِهِ الْبَلْدَةِ الَّذِي حَرَّمَهَا) **-** (ey Məhəmməd, de ki,) **həqiqətən, mən əmr olunmuşam ki, gərək** (bu Məkkə) **şəhərinin* rəbbi Allah-Təalaya ibadət edim, hansı ki O,** (bu Məkkə şəhərinə şərəf verib, ona hörmətsizlik etməyi) **haram edibdir.** (وَلَهُ كُلُّ شَيْءٍ) **- hər bir şeyin** (yaradılması və hakimiyyəti də) **Allah-Təalaya aiddir** (وَاُمِرْتُ اَنْ اَكُونَ مِنَ الْمُسْلِمِينَ) **-** (Hz. Peyğəmbər deyir:) **mən əmr olunmuşam** (ağlım əmr edir) **ki, gərək** (Allah-Təalaya ixlasla) **itaət edənlərdən olam.**

*(*Qeyd: Hər bir ölkə və şəhər Allah-Təalanındır, amma Allah-Təalanın özgə şəhərlərin arasından Məkkəni seçib özünə isnad etməsinin səbəbi Məkkənin şərəfini bəyan etməkdən ötrüdür. Hz. Peyğəmbər Məkkədən Mədinəyə hicrət edəndə yolda üzünü Məkkəyə tutub dedi: "Mən bilirəm, ey Məkkə, sən Allah-Təalanın şəhərlərinin ara-*

وَاَنْ اَتْلُوَا الْقُرْاٰنَۚ فَمَنِ اهْتَدٰى فَاِنَّمَا يَهْتَد۪ي لِنَفْسِه۪ۚ وَمَنْ ضَلَّ فَقُلْ اِنَّمَٓا اَنَا۬ مِنَ الْمُنْذِر۪ينَ ﴿٩٢﴾ وَقُلِ الْحَمْدُ لِلّٰهِ سَيُر۪يكُمْ اٰيَاتِه۪ فَتَعْرِفُونَهَاۜ وَمَا رَبُّكَ بِغَافِلٍ عَمَّا تَعْمَلُونَ ﴿٩٣﴾

---

*sında hamısından artıq Ona sevimlisən, əgər sənin əhlin məni qovmasaydı, heç vaxt səndən getməzdim." "Vətən sevgisi imandandır"* (Acluni, Kəşful-Xəfa, II/345), *-hədisinin həqiqətini buradan anlaya bilərik. Vətəndən məqsəd axirətdir, yoxsa bu dünyadakı vətəndir? Əsl məqsəd bu dünyada vətəni sevib, öz millətinə, dininə, məzhəbinə yardım edib rəvac verməkdir. Axirəti sevməyin mənfəəti şəxsin özünə aiddir, Hz. Peyğəmbərin hədisini belə böyük bir mənadan məhrum edib, onun öz şəxsi axirət mənfəətinə isnad etmək ağıla zidd olan bir şeydir).*

**92)** (وَاَنْ اَتْلُوَا الْقُرْاٰنَ) **-** (Hz. peyğəmbər deyir: "Və əmr olunmuşam ki,) **gərək Quran oxuyub** (ehkamına əməl edəm)"**,** (فَمَنِ اهْتَدٰى فَاِنَّمَا يَهْتَد۪ي لِنَفْسِه۪) – (Allah-Təala mənə əmr edib buyurur: "Ey Məhəmməd)**, kim** (Qurana tabe olub) **hidayət yolunda olsa, onun hidayətinin faydası özünədir.** (وَمَنْ ضَلَّ فَقُلْ اِنَّمَٓا اَنَا۬ مِنَ الْمُنْذِر۪ينَ) **- və kim** (Qurana tabe olmayıb) **haqq yolundan çıxsa,** (ey Məhəmməd, o şəxslərə) **de ki, həqiqətən,** (sizin zəlalətə düşmənizdən mənə bir zərər gəlməz)**. Mən ancaq** (Allah-Təala tərəfindən gələn əvvəlki peyğəmbərlər kimi sizi ilahi əzabla) **qorxudan peyğəmbərəm,** (hər bir işinizin ixtiyarı isə Allah-Təaladadır)**."**

**93)** (وَقُلِ الْحَمْدُ لِلّٰهِ) **-** (ey Məhəmməd)**, de ki, həmd-səna ancaq Allah-Təalaya məxsusdur** (və bütün həmdlərin dönüşü Allah-Təalayadır)**.** (سَيُر۪يكُمْ اٰيَاتِه۪) **- Allah-Təala** (tezliklə öz kamil qüdrətinə işarə edən) **sübutları sizə göstərəcək.** (فَتَعْرِفُونَهَا) **- o vaxt da biləcəksiniz** (ki, Allah-Təala hər bir şeyə qadirdir. Hz. Peyğəmbər Məkkədən hicrət edəndən sonra Allah-Təala müsəlmanları Qüreyşə qalib edib, öz sübutlarını onlara göstərib, peyğəmbərinin haqq olduğunu aləmə bildirdi)**.** (وَمَا رَبُّكَ بِغَافِلٍ عَمَّا تَعْمَلُونَ) **-** (ey Məhəmməd)**, sənin rəbbin Allah-Təala etdiyiniz əməllərdən qafil deyil.** (Nə etsəniz, agah olub, cəzanızı verəcəkdir)**.**

Allaha həmd olsun ki, Nəml surəsinin təfsiri bitdi. Bu surədə zikr olunan Süleymanın hakimiyyətinə dair hikmətlər Allah-Təalanın kamil qüdrətinə böyük dəlil və sübutdur. Qurani-Şərifdə zikr olunan qissələrin ehtiva etdiyi dərin mənaları dərk etmək böyük səadətdir. Hərçənd bu zamana kimi Qurani-Şərifin bütün mənalarını olduğu kimi dərk etməyə heç kim müvəffəq olmayıb, amma imkan nisbətində, gərək, səy edib, zamanın şərtlərinə görə, o mənaları anlamaq lazımdır. Hz. peyğəmbər buyurubdur: "Kim Nəml surəsini oxusa, Allah-Təala ona 10 savab bəxş edər və qiyamət günü – "la ilahə illəllah" deyərək qəbirdən qalxar." (Qazi Beyzavi, Ənvarut-Tənzil, IV/546)



## əl-QƏSƏS SURƏSİ

28-ci surədir. Məkkədə nazil olub, 88 ayə, 1441 kəlmə, 5755 hərfdir.



بِسْمِ اللّٰهِ الرَّحْمٰنِ الرَّحِيمِ ﴿﴾ طٰسٓمٓ ﴿١﴾ تِلْكَ اٰيَاتُ الْكِتَابِ الْمُبِينِ ﴿٢﴾ نَتْلُوا عَلَيْكَ مِنْ
نَبَاِ مُوسٰى وَفِرْعَوْنَ بِالْحَقِّ لِقَوْمٍ يُؤْمِنُونَ ﴿٣﴾ اِنَّ فِرْعَوْنَ عَلَا فِي الْاَرْضِ وَجَعَلَ اَهْلَهَا شِيَعًا
يَسْتَضْعِفُ طَٓائِفَةً مِنْهُمْ يُذَبِّحُ اَبْنَٓاءَهُمْ وَيَسْتَحْيِي نِسَٓاءَهُمْ اِنَّهُ كَانَ مِنَ الْمُفْسِدِينَ ﴿٤﴾ وَنُرِيدُ اَنْ نَمُنَّ
عَلَى الَّذِينَ اسْتُضْعِفُوا فِي الْاَرْضِ وَنَجْعَلَهُمْ اَئِمَّةً وَنَجْعَلَهُمُ الْوَارِثِينَ ﴿٥﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1)** (طٰسٓمٓ) **- bu mübarək surənin adıdır.**

**2)** (تِلْكَ اٰيَاتُ الْكِتَابِ الْمُبِينِ) **- bu** (surədə zikr olunan ayələr hikmət elmini, halal, haramı bəyan edən) **açıq-aşkar** (Quran) **ayələridir.**

**3)** (نَتْلُوا عَلَيْكَ مِنْ نَبَاِ مُوسٰى وَفِرْعَوْنَ بِالْحَقِّ لِقَوْمٍ يُؤْمِنُونَ) **-** (ey Məhəmməd)**, Musa və fironun xəbərlərindən** (bir qismini heç bir şübhə olmadan) **haqq və doğruluqla sənə oxuyuruq ki,** (sənə) **iman gətirənlər** (fayda əldə etsinlər, çünki inadkar olub iman etməyənlərə heç bir nəsihət fayda verməz)**.**

**4)** (اِنَّ فِرْعَوْنَ عَلَا فِي الْاَرْضِ) **- həqiqətən, firon** (Misir) **torpağında** (xalqa hakim olub) **zülm və tüğyan edirdi.** (وَجَعَلَ اَهْلَهَا شِيَعًا) – (Misirin) **əhlini də zümrələrə bölüb** (hər birinə bir iş tapşırmışdı. O dövrdə Misirdə bənnalıq sənəti xeyli inkişaf etdiyindən onların əksəriyyətini bənnalıqda işlədib böyük binalar tikdirdi. İndi də Misirdə olan ehramların zəmanənin gərdişinə dözüb, min illərlə ayaqda qalması o dövrdə bənnalıq elminin son dərəcə inkişaf etdiyinə böyük dəlildir)**.** (يَسْتَضْعِفُ طَٓائِفَةً مِنْهُمْ) **- onlardan olan bir tayfanı** (bəni-İsraili) **zəif və gücsüz sanıb,** (يُذَبِّحُ اَبْنَٓاءَهُمْ وَيَسْتَحْيِي نِسَٓاءَهُمْ اِنَّهُ كَانَ مِنَ الْمُفْسِدِينَ) **- oğullarını kəsib** (öldürür)**, qızlarını sağ qoyurdu, həqiqətən, firon fəsadçılardan idi.** (Misirdə kahinlərdən biri ona xəbər vermişdi ki, bəni-İsraildən bir oğlan uşağı doğulub, sənin səltənətini yıxacaq. Kahinin bu sözünə görə, o, bəni-İsraildə yeni doğulan oğlan uşaqlarının öldürülməsini əmr etmişdi)**.**

**5)** (وَنُرِيدُ اَنْ نَمُنَّ عَلَى الَّذِينَ اسْتُضْعِفُوا فِي الْاَرْضِ وَنَجْعَلَهُمْ اَئِمَّةً) – (ey Məhəmməd, firon bəni-İsraili zəif hesab edib onlara əzab edirdi. Amma) **biz istədik ki, zəif** (bəni-İsrailə Misir) **torpağında lütf edib onları** (din və dünya işlərində) **rəhbər** (peyğəmbər) **edək.** (وَنَجْعَلَهُمُ الْوَارِثِينَ) **- və onları** (fironun və qibtilərin mülkünə) **varis edək.**

وَنُمَكِّنَ لَهُمْ فِي الْاَرْضِ وَنُرِيَ فِرْعَوْنَ وَهَامَانَ وَجُنُودَهُمَا مِنْهُمْ مَا كَانُوا يَحْذَرُونَ ﴿٦﴾ وَاَوْحَيْنَآ
اِلٰٓى اُمِّ مُوسٰٓى اَنْ اَرْضِعيهِۚ فَاِذَا خِفْتِ عَلَيْهِ فَاَلْقِيهِ فِي الْيَمِّ وَلَا تَخَافِي وَلَا تَحْزَنِيۚ اِنَّا رَآدُّوهُ اِلَيْكِ
وَجَاعِلُوهُ مِنَ الْمُرْسَلِينَ ﴿٧﴾ فَالْتَقَطَهُٓ اٰلُ فِرْعَوْنَ لِيَكُونَ لَهُمْ عَدُوًّا وَحَزَنًاۜ اِنَّ فِرْعَوْنَ وَهَامَانَ
وَجُنُودَهُمَا كَانُوا خَاطِئِينَ ﴿٨﴾ وَقَالَتِ امْرَاَتُ فِرْعَوْنَ قُرَّتُ عَيْنٍ لِي وَلَكَۜ لَا تَقْتُلُوهُۗ عَسٰٓى اَنْ يَنْفَعَنَآ
اَوْ نَتَّخِذَهُ وَلَدًا وَهُمْ لَا يَشْعُرُونَ ﴿٩﴾

---

**6)** (وَنُمَكِّنَ لَهُمْ فِي الْاَرْضِ) – (yenə biz istədik ki, bəni-İsraili Misir) **torpağında möhkəmləndirib** (hakim edək). (وَنُرِيَ فِرْعَوْنَ وَهَامَانَ وَجُنُودَهُمَا مِنْهُمْ مَا كَانُوا يَحْذَرُونَ) – (yenə biz istədik ki,) **firon və Hamana, onların qoşunlarına qorxduqları şeyi göstərək.** (Onlar bəni-İsraildən bir nəfərin dünyaya gəlib onların səltənətini yıxacağından qorxurdular. Allah-Təala da bu qorxduğu şeyi onların başına gətirib, Musanı onlara göndərib özlərini həlak, səltənətlərini məhv etdi)**.**

**7)** (وَاَوْحَيْنَآ اِلٰى اُمِّ مُوسٰى اَنْ اَرْضِعِيهِ) - (ey Məhəmməd, Musa anadan olduqda)**, vəhy edib Musanın anasına dedik ki,** (Musanı) **əmizdir.** (فَاِذَا خِفْتِ عَلَيْهِ فَاَلْقِيهِ فِي الْيَمِّ) – (Musanın qətl edilməsindən) **qorxduğunda, o vaxt onu** (Nil çayına) **at.** (وَلَا تَخَافِي وَلَا تَحْزَنِي) – (Musa üçün) **qorxma və məhzun olma,** (اِنَّا رَآدُّوهُ اِلَيْكِ) **- həqiqətən, biz onu sənə qaytarıb,** (وَجَاعِلُوهُ مِنَ الْمُرْسَلِينَ) **- onu** (bizim tərəfimizdən göndərilən) **peyğəmbərlərdən edəcəyik.**

**8)** (فَالْتَقَطَهُٓ اٰلُ فِرْعَوْنَ لِيَكُونَ لَهُمْ عَدُوًّا وَحَزَنًا) – (Musanın anası qırlanmış bir sandığın içində Musanı Nil çayına atdı, sandıq da gedib fironun bağına düşdü)**. Fironun adamları sandığı tapıb,** (Musanı) **onun içindən çıxartdılar ki, onlardan ötrü düşmən və qəm-qüssələrinə bais olsun.** (İnsan özünə əziz olan bir şeyi tapıb mühafizə edər ki, özünün sevinc və şadlığına bais olsun, nəinki ondan ötrü qəm-qüssə çəksin. Fironun ailəsi də Musanı tapıb özlərinə oğul etdilər ki, onlardan ötrü şadlıq səbəbi olsun, amma Allah-Təala Musanı fironun qövmünə düçar edib həlak etdirəcəyindən, bu ayədə buyurur ki, Musanı tapdılar ki, qəm-qüssələrinə bais olsun)**.** (اِنَّ فِرْعَوْنَ وَهَامَانَ وَجُنُودَهُمَا كَانُوا خَاطِئِينَ) **- həqiqətən, firon və** (vəziri) **Haman, onların qoşunları** (hər bir işdə) **xəta edənlərdən idilər.** (Musanı sandığın içində tapdıqlarında, dedilər ki, bu həmin uşaqdır ki, fironun səltənətini yıxacaq, istədilər, onu qətlə yetirsinlər, fironun arvadı Asiya onlara mane oldu, necə ki növbəti ayədə buyurur)**.**

**9)** (وَقَالَتِ امْرَاَتُ فِرْعَوْنَ قُرَّتُ عَيْنٍ لِي وَلَكَ) **- fironun arvadı** (Asiya firona) **dedi:** (bu uşaq) **mənim və sənin üçün göz nurudur.** (لَا تَقْتُلُوهُ عَسٰى اَنْ يَنْفَعَنَآ اَوْ نَتَّخِذَهُ وَلَدًا) – (onu) **qətlə yetirməyin,** (bu uşağın simasından nəciblik yağır)**, ola bilər ki, bizə mənfəət versin, ya da onu özümüzə övlad götürək.** (Çünki bu uşaq padşah övladı olmağa layiqdir)**.** (وَهُمْ لَا يَشْعُرُونَ) – (Musadan mənfəət, ya da

وَاَصْبَحَ فُؤَادُ اُمِّ مُوسٰى فَارِغًاۜ اِنْ كَادَتْ لَتُبْد۪ي بِه۪ لَوْلَٓا اَنْ رَبَطْنَا عَلٰى قَلْبِهَا لِتَكُونَ مِنَ الْمُؤْمِن۪ينَ
﴿١٠﴾ وَقَالَتْ لِاُخْتِه۪ قُصّ۪يهِۘ فَبَصُرَتْ بِه۪ عَنْ جُنُبٍ وَهُمْ لَا يَشْعُرُونَۙ ﴿١١﴾ وَحَرَّمْنَا عَلَيْهِ الْمَرَاضِعَ
مِنْ قَبْلُ فَقَالَتْ هَلْ اَدُلُّكُمْ عَلٰٓى اَهْلِ بَيْتٍ يَكْفُلُونَهُ لَكُمْ وَهُمْ لَهُ نَاصِحُونَ ﴿١٢﴾

---

övladlıq gözləməklə xəta etdilər. Musanın Allah-Təala tərəfindən onlara bir fayda yox, bir bəla olacağını) **bilmədilər.**

**10)** (وَاَصْبَحَ فُؤَادُ اُمِّ مُوسٰى فَارِغًا) – (Musanı suya saldıqdan sonra)**, Musanın anasının qəlbi** (onun ayrılığına dözməyib, bir şeyi dərk etməkdən xali) **bom-boş oldu,** (dəli kimi oldu)**,** (اِنْ كَادَتْ لَتُبْد۪ي بِه۪ لَوْلَٓا اَنْ رَبَطْنَا عَلٰى قَلْبِهَا)– (ey Məhəmməd), **əgər biz onun qəlbini möhkəm etməsəydik, az qala** (Musanın öz oğlu olduğunu və ona görə ah-nalə etdiyini) **aşkar edəcəkdi.** (لِتَكُونَ مِنَ الْمُؤْمِن۪ينَ) – (biz onun qəlbini möhkəm etdik ki, ona verdiyimiz vədə - Musanın ona qaytarılacağına) **inanan möminlərdən olsun.**

**11)** (وَقَالَتْ لِاُخْتِه۪ قُصّ۪يهِ) – (Musanı suya atandan sonra anasının qəlbi narahat olub öz qızına – Musanın) **bacısına dedi: "Onun dalınca get** (bir xəbər gətir)**."** (فَبَصُرَتْ بِه۪ عَنْ جُنُبٍ وَهُمْ لَا يَشْعُرُونَ) – (Musanın bacısı çayın kənarıyla gedib sandığın fironun bağına daxil olduğunu gördü, fironun adamları ondan) **xəbərsiz bir halda uzaqdan Musanı gördü,** (Musanın sandığın içindən çıxarıldığını görüb, gedib anasına xəbər verdi, Musanın anası onun fironun əlinə düşməsindən xəbərdar olduqda, ağlı başından gedib dəli kimi oldu, necə ki əvvəlki ayədə zikr olundu, bacısı yenidən ora gəlib gördü ki, onu əmizdirmək üçün dayələr gətirirlər, amma Musa onların heç birinin südünü əmmir, necə ki növbəti ayədə xəbər verir)**.**

**12)** (وَحَرَّمْنَا عَلَيْهِ الْمَرَاضِعَ مِنْ قَبْلُ) – (Musanı anasına qaytarmadan) **əvvəl bütün süd analarının** (südünü) **ona haram etdik.** (Yəni Musanın başqa qadınların südünü əmməsinə mane olduq. Heç birinin südünü əmmədi)**.** (فَقَالَتْ هَلْ اَدُلُّكُمْ عَلٰٓى اَهْلِ بَيْتٍ يَكْفُلُونَهُ لَكُمْ) – (Musanın bacısı Musanın heç bir qadının südünü əmmədiyini gördükdə gedib) **dedi: "Sizin üçün ona baxıb** (süd verəcək) **bir ailə göstərimmi?** (وَهُمْ لَهُ نَاصِحُونَ) **– həm də** (firona görə bu uşağa qarşı) **ehtiramlı olub** (səmimi-qəlbdən ona xidmət edib qoruyar. Musanın bacısından bu sözü eşidəndə dedilər: "Get o arvadı gətir." O da dərhal gedib anasını gətirdi, Musa anasının ətrini duyan kimi, onun südünü əmməyə başladı. Musanın anasına dedilər: "Səbəb nədir ki, bu uşaq səndən başqa, heç bir qadının südünü əmmir?" Musanın anası dedi: "Mən pak və təmiz, gözəl ətirli qadınam. Hər bir uşaq mənim südümü əmər." Uşağı öz anasına tapşırıb, müəyyən bir ücrət qarşılığında onu əmizdirməsini buyurdular. Musanın anası uşağını götürüb öz evinə getdi, qəlbi də rahat oldu. Allah-Təala Musanın anasına verdiyi – uşağını sənə qaytaracağam vədinə əməl etdi. Necə ki, növbəti ayədə xəbər verir)**.**

فَرَدَدْنَاهُ اِلٰىٓ اُمِّهٖ كَيْ تَقَرَّ عَيْنُهَا وَلَا تَحْزَنَ وَلِتَعْلَمَ اَنَّ وَعْدَ اللّٰهِ حَقٌّ وَلٰكِنَّ اَكْثَرَهُمْ لَا يَعْلَمُونَ ﴿١٣﴾
وَلَمَّا بَلَغَ اَشُدَّهُ وَاسْتَوٰىٓ اٰتَيْنَاهُ حُكْمًا وَعِلْمًاۜ وَكَذٰلِكَ نَجْزِي الْمُحْسِنِينَ ﴿١٤﴾ وَدَخَلَ الْمَدِينَةَ عَلٰى
حِينِ غَفْلَةٍ مِنْ اَهْلِهَا فَوَجَدَ فِيهَا رَجُلَيْنِ يَقْتَتِلَانِۘ هٰذَا مِنْ شِيعَتِهٖ وَهٰذَا مِنْ عَدُوِّهٖۚ فَاسْتَغَاثَهُ الَّذٖي مِنْ
شِيعَتِهٖ عَلَى الَّذٖي مِنْ عَدُوِّهٖۙ فَوَكَزَهُ مُوسٰى فَقَضٰى عَلَيْهِۘ قَالَ هٰذَا مِنْ عَمَلِ الشَّيْطَانِۘ

---

**13)** (فَرَدَدْنَاهُ اِلٰى اُمِّهٖ) – (vəd etdiyimiz kimi) **onu anasına qaytardıq.** (كَيْ تَقَرَّ عَيْنُهَا وَلَا تَحْزَنَ) - **ta ki,** (bu səbəbdən anasının) **gözü aydın olub məhzun və qəmgin olmasın.** (وَلِتَعْلَمَ اَنَّ وَعْدَ اللّٰهِ حَقٌّ) – **həm də bilsin ki, Allah-Təalanın vədi haqdır,** (verdiyi vədə əməl edəndir)**.** (وَلٰكِنَّ اَكْثَرَهُمْ لَا يَعْلَمُونَ) **- lakin** (insanların) **əksəriyyəti** (Allah-Təalanın verdiyi vədə sadiq olduğunu) **bilməyib,** (buna şübhə və ya inkar edirlər. Musanın 2 yaşı tamam olub süddən ayrıldıqda fironun evində ona tərbiyə verməyə başladılar, fironun oğullarından biri kimi sayıldı. 40 yaşına çatdıqda şəhərdən çıxıb Misirə gedərkən Turi-Sinada Allah-Təala ona hikmət elmi və peyğəmbərlik bəxş etdi. Bu əhvalatın təfsilatı növbəti ayələrdə zikr olunacaqdır)**.**

**14)** (وَلَمَّا بَلَغَ اَشُدَّهُ وَاسْتَوٰى) **- Musa yetkinləşib** (kamillik yaşı olan 40 yaşına) **çatdıqda,** (اٰتَيْنَاهُ حُكْمًا وَعِلْمًا) – **o vaxt ona** (Turi-Sinada) **hikmət və elm** (Tövratı) **bəxş etdik.** (وَكَذٰلِكَ نَجْزِي الْمُحْسِنِينَ) – (Musa və anasına lütf və kəramət etdiyimiz kimi) **yaxşı əməl sahiblərinə də belə mükafat verərik.** (Bu ayədə Musanın əhvalatı müxtəsər şəkildə bəyan edilib, bundan sonra onun əhvalatı təfsilatı ilə bəyan ediləcək)**.**

**15)** (وَدَخَلَ الْمَدِينَةَ عَلٰى حِينِ غَفْلَةٍ مِنْ اَهْلِهَا) – (bir gün) **camaat** (öz evlərində istirahət edib hər bir şeydən) **xəbərsiz ikən** (Musa) **şəhərə daxil oldu.** (O dövrdə Misirin paytaxtı Qahirədən bir neçə mil kənarda Nil sahilində olan Menfis şəhəri idi. İndi də xarabalıqları mövcuddur)**.** (فَوَجَدَ فِيهَا رَجُلَيْنِ يَقْتَتِلَانِ) – (şəhərdə səyahət edərkən) **iki nəfərin dalaşdığını gördü.** (هٰذَا مِنْ شِيعَتِهٖ وَهٰذَا مِنْ عَدُوِّهٖ) – (gördü ki, dalaşanlardan) **biri öz tərəfdarlarından** (bəni-İsraildən)**, digəri onun düşmənlərindən** (qibtilərdəndir. Qibtilər hakim millət olduqlarından bəni-İsrailə çox zülm edirdilər. Amma Musa firon xanədanından olduğundan bəni-İsraili qibtilərin zülmündən mühafizə edirdi. Bəni-İsrail də Musanın bəni-İsraildən olduğunu bilib, qibtilərin arasında Musaya görə iftixar edirdilər)**.** (فَاسْتَغَاثَهُ الَّذٖي مِنْ شِيعَتِهٖ عَلَى الَّذٖي مِنْ عَدُوِّهٖ) – (bəni-İsraildən, Musanın) **tərəfdarlarından olan şəxs** (Musanı tanıyıb) **ondan kömək istədi.** (Belə ki, düşmənini dəf etməyə ona kömək etsin)**.** (فَوَكَزَهُ مُوسٰى فَقَضٰى عَلَيْهِ) **–Musa** (qibtinin israilliyə zülm etdiyini görüb, mane olmaq üçün) **ona** (bir sillə, ya da bir yumruq) **vurub öldürdü.** (قَالَ هٰذَا مِنْ عَمَلِ الشَّيْطَانِ) - (Musanın qəsdi onu öldürmək olmadığından qibtinin öldüyünü gördükdə)**, dedi: "Bu, şeytan**

اِنَّهُ عَدُوٌّ مُضِلٌّ مُبِينٌ ﴿١٥﴾ قَالَ رَبِّ اِنّ۪ي ظَلَمْتُ نَفْس۪ي فَاغْفِرْ ل۪ي فَغَفَرَ لَهُۜ اِنَّهُ هُوَ الْغَفُورُ الرَّح۪يمُ
﴿١٦﴾ قَالَ رَبِّ بِمَٓا اَنْعَمْتَ عَلَيَّ فَلَنْ اَكُونَ ظَه۪يرًا لِلْمُجْرِم۪ينَ ﴿١٧﴾ فَاَصْبَحَ فِي الْمَد۪ينَةِ خَٓائِفًا
يَتَرَقَّبُ فَاِذَا الَّذِي اسْتَنْصَرَهُ بِالْاَمْسِ يَسْتَصْرِخُهُۜ قَالَ لَهُ مُوسٰٓى اِنَّكَ لَغَوِيٌّ مُب۪ينٌ ﴿١٨﴾ فَلَمَّٓا اَنْ اَرَادَ
اَنْ يَبْطِشَ بِالَّذ۪ي هُوَ عَدُوٌّ لَهُمَاۙ قَالَ يَا مُوسٰٓى اَتُر۪يدُ اَنْ تَقْتُلَن۪ي كَمَا قَتَلْتَ نَفْسًا بِالْاَمْسِۗ اِنْ تُر۪يدُ اِلَّٓا
اَنْ تَكُونَ جَبَّارًا فِي الْاَرْضِ وَمَا تُر۪يدُ اَنْ تَكُونَ مِنَ الْمُصْلِح۪ينَ ﴿١٩﴾

---

**əməlindəndir.** (اِنَّهُ عَدُوٌّ مُضِلٌّ مُب۪ينٌ) **- həqiqətən,** (şeytan insanı) **zəlalətə salan açıq-aşkar düşməndir.”**

**16)** (قَالَ رَبِّ اِنّ۪ي ظَلَمْتُ نَفْس۪ي فَاغْفِرْ ل۪ي) – (Musa) **dedi: “Ey mənim rəbbim,** (bu qibtini qətlə yetirməklə) **özümə zülm etdim. Məni bağışlayıb günahımdan keç.”** (فَغَفَرَ لَهُۜ اِنَّهُ هُوَ الْغَفُورُ الرَّح۪يمُ) - (qibti zalım olduğundan Allah-Təala Musanı bağışlayıb (təqsirindən keçdi)**. Həqiqətən,** (Allah tövbə edənləri) **rəhm edib bağışlayandır.** (Qibti müşrik olub Allah-Təala yanında heç bir dəyəri olmadığından Allah-Təala Musanı bağışladı. Amma ayədən belə məlum olur ki, müşrik də olsa, səbəbsiz yerə zülm edib onu öldürmək günah sayılır, diqqət edilsin)**.**

**17)** (قَالَ رَبِّ بِمَٓا اَنْعَمْتَ عَلَيَّ فَلَنْ اَكُونَ ظَه۪يرًا لِلْمُجْرِم۪ينَ) – (Musa) **dedi: “Ey mənim rəbbim,** (məni bağışlayıb)**, verdiyin nemət haqqı bir də günahkar,** (zalım, müşrik) **şəxslərə kömək etmərəm.”**

**18)** (فَاَصْبَحَ فِي الْمَد۪ينَةِ خَٓائِفًا يَتَرَقَّبُ) – (Musa nə olacaq deyə) **qorxu içində gözləyə-gözləyə səhəri şəhərdə qarşıladı,** (lakin qibtilər qatilin kim olduğunu bilməyib hələ onu axtarırdılar)**.** (فَاِذَا الَّذِي اسْتَنْصَرَهُ بِالْاَمْسِ يَسْتَصْرِخُهُ) – (ertəsi gün Musa çıxıb şəhərdə dolanırdı)**. Bir də nə gördü, dünən yardım etdiyi** (israilli yenə bir başqa qibtiylə dava edib, onu) **yardıma çağırır.** (قَالَ لَهُ مُوسٰٓى اِنَّكَ لَغَوِيٌّ مُب۪ينٌ) **- Musa** (dünənki israillinin yenə dalaşdığını gördükdə) **dedi: “Həqiqətən, sən açıq-aşkar azğınsan.** (Hər gün biri ilə dava edirsən)**.”**

**19)** (فَلَمَّٓا اَنْ اَرَادَ اَنْ يَبْطِشَ بِالَّذ۪ي هُوَ عَدُوٌّ لَهُمَا) – (Musa israilliyə qəzəblənsə də, onun məğlub olacağını görüb ona yardım etmək istədi)**. Hər ikisinin** (özünün və o israillinin) **düşməni olan** (o qibtiyə hücum edib) **yaxalamaq istədikdə** (قَالَ يَا مُوسٰٓى اَتُر۪يدُ اَنْ تَقْتُلَن۪ي كَمَا قَتَلْتَ نَفْسًا بِالْاَمْسِ) – (israilli Musanın ona dediyi sözlərdən güman etdi ki, Musa ona hücum edəcək)**. Dedi: “Ey Musa, dünən birini öldürdüyün kimi, məni də öldürmək istəyirsən,** (اِنْ تُر۪يدُ اِلَّٓا اَنْ تَكُونَ جَبَّارًا فِي الْاَرْضِ) **- sən ancaq** (Misir) **torpağında zalım olub** (aqibətini düşünmədən camaatı qırmaq istəyirsən), (وَمَا تُر۪يدُ اَنْ تَكُونَ مِنَ الْمُصْلِح۪ينَ) - (ey Musa, sən insanları) **islah edən xeyirxahlardan olmaq istəmirsən.”**

وَجَآءَ رَجُلٌ مِنْ اَقْصَا الْمَدِينَةِ يَسْعٰىۘ قَالَ يَا مُوسٰٓى اِنَّ الْمَلَاَ يَأْتَمِرُونَ بِكَ لِيَقْتُلُوكَ فَاخْرُجْ اِنّ۪ي لَكَ
مِنَ النَّاصِح۪ينَ ﴿٢٠﴾ فَخَرَجَ مِنْهَا خَٓائِفًا يَتَرَقَّبُۘ قَالَ رَبِّ نَجِّن۪ي مِنَ الْقَوْمِ الظَّالِم۪ينَ۟ ﴿٢١﴾ وَلَمَّا
تَوَجَّهَ تِلْقَٓاءَ مَدْيَنَ قَالَ عَسٰى رَبّ۪ٓي اَنْ يَهْدِيَن۪ي سَوَٓاءَ السَّب۪يلِ ﴿٢٢﴾ وَلَمَّا وَرَدَ مَٓاءَ مَدْيَنَ وَجَدَ عَلَيْهِ
اُمَّةً مِنَ النَّاسِ يَسْقُونَۘ وَوَجَدَ مِنْ دُونِهِمُ امْرَاَتَيْنِ تَذُودَانِۚ قَالَ مَا خَطْبُكُمَاۜ قَالَتَا لَا نَسْق۪ي حَتّٰى يُصْدِرَ
الرِّعَٓاءُ وَاَبُونَا شَيْخٌ كَب۪يرٌ ﴿٢٣﴾ فَسَقٰى لَهُمَا ثُمَّ تَوَلّٰٓى اِلَى الظِّلِّ

---

**20)** (وَجَٓاءَ رَجُلٌ مِنْ اَقْصَا الْمَدِينَةِ يَسْعٰى) – (israilli Musaya bu sözü dedikdə dünənki qibtinin qatilinin Musa olduğu xəbəri firona çatdırıldı, vəzirlər məşvərət edib Musanın qətlinə hökm verdilər). **Şəhərin kənarında** (qalan Musanın dostlarından) **bir nəfər** (bu xəbəri eşidib) **sürətlə gedib** (Musaya xəbər verdi). (قَالَ يَا مُوسٰى اِنَّ الْمَلَاَ يَأْتَمِرُونَ بِكَ لِيَقْتُلُوكَ) **- dedi: "Ey Musa, əyanlar səni öldürmək üçün məşvərət edirlər,** (فَاخْرُجْ اِنّ۪ي لَكَ مِنَ النَّاصِح۪ينَ) – **dərhal** (bu şəhərdən) **çıx get. Həqiqətən, mən sənə** (xeyirli) **nəsihət edənlərdənəm."**

**21)** (فَخَرَجَ مِنْهَا خَٓائِفًا يَتَرَقَّبُ) – (Musa) **qorxaraq şəhərdən çıxıb gözləyirdi** (ki, birdən onu tutarlar). (قَالَ رَبِّ نَجِّن۪ي مِنَ الْقَوْمِ الظَّالِم۪ينَ) **- dedi: "Ey mənim rəbbim, məni zalım olan** (bu qibti) **qövmündən xilas et."**

**22)** (وَلَمَّا تَوَجَّهَ تِلْقَٓاءَ مَدْيَنَ) – (Misirdən çıxıb Şüeyb peyğəmbərin yaşadığı) **Mədyən** (şəhərinə) **tərəf yönəldikdə** (قَالَ عَسٰى رَبّ۪ٓي اَنْ يَهْدِيَن۪ي سَوَٓاءَ السَّب۪يلِ) – (yola nabələd olduğu üçün Allah-Təalaya dua edib) **dedi: "Ümidvaram ki, rəbbim mənə hidayət edib doğru yolu göstərsin.** (Allah-Təala onun ümidini qırmayıb duasını qəbul etdi, o da birbaş Mədyən yolu ilə şəhərin kənarındakı su hövzəsinə gəlib çatdı, necə ki sıradakı ayədə xəbər verir).

**23)** (وَلَمَّا وَرَدَ مَٓاءَ مَدْيَنَ وَجَدَ عَلَيْهِ اُمَّةً مِنَ النَّاسِ يَسْقُونَ) – (Musa) **Mədyəndəki su hövzəsinə çatdıqda orada** (heyvanlarını suvaran) **bir camaat gördü.** (وَوَجَدَ مِنْ دُونِهِمُ امْرَاَتَيْنِ تَذُودَانِ) **- onlardan başqa** (heyvanlarının su içməyə getməsinə) **mane olan iki qadın da gördü.** (قَالَ مَا خَطْبُكُمَا) – (Musa qeyrətli bir şəxs olduğundan o qadınlara) **dedi: "Dərdiniz nədir?"** (Niyə heyvanların su içməsinə mane olursunuz?) (قَالَتَا لَا نَسْق۪ي حَتّٰى يُصْدِرَ الرِّعَٓاءُ) **- dedilər: "**(qadın olduğumuza görə kişilərin arasına girə bilmirik). **Onlar suvarıb qurtarana qədər biz** (heyvanlarımızı) **suvarmarıq,** (ancaq onlardan sonra hövzədə qalan su ilə heyvanlarımızı suvarırıq). (وَاَبُونَا شَيْخٌ كَب۪يرٌ) **- atamız da ixtiyar bir qocadır."** (Heyvanları suvarmağa gücü yoxdur, bu səbəbdən biz gəlib suvarırıq).

**24)** (فَسَقٰى لَهُمَا) – (Hz. Musa özü uzun yol gəlib, ayaqları qabar, özü ac olsa da, Şüeybin qızları olan o iki qadına mərhəmət edib) **heyvanlarını suvardı,** (yemək yeməyə son dərəcə ehtiyacı olduğu halda onlardan yemək də istəmədi). (ثُمَّ تَوَلّٰى اِلَى الظِّلِّ) – (onların heyvanlarını suvarandan) **sonra** (yoru-

فَقَالَ رَبِّ اِنِّي لِمَآ اَنْزَلْتَ اِلَيَّ مِنْ خَيْرٍ فَقِيرٌ ﴿٢٤﴾ فَجَآءَتْهُ اِحْدٰيهُمَا تَمْشِي عَلَى اسْتِحْيَآءٍ قَالَتْ اِنَّ
اَبِي يَدْعُوكَ لِيَجْزِيَكَ اَجْرَ مَا سَقَيْتَ لَنَاۜ فَلَمَّا جَآءَهُ وَقَصَّ عَلَيْهِ الْقَصَصَۙ قَالَ لَا تَخَفْ نَجَوْتَ مِنَ الْقَوْمِ
الظَّالِمِينَ ﴿٢٥﴾ قَالَتْ اِحْدٰيهُمَا يَآ اَبَتِ اسْتَأْجِرْهُ اِنَّ خَيْرَ مَنِ اسْتَأْجَرْتَ الْقَوِيُّ الْاَمِينُ ﴿٢٦﴾ قَالَ اِنِّيٓ
اُرِيدُ اَنْ اُنْكِحَكَ اِحْدَى ابْنَتَيَّ هَاتَيْنِ عَلٰٓى اَنْ تَأْجُرَنِي ثَمَانِيَ حِجَجٍ فَاِنْ اَتْمَمْتَ عَشْرًا فَمِنْ عِنْدِكَ

---

lub) **bir ağacın kölgəsinə gedib əyləşdi.** (فَقَالَ رَبِّ اِنِّي لِمَا اَنْزَلْتَ اِلَيَّ مِنْ خَيْرٍ فَقِيرٌ) **- dedi: "Ey mənim rəbbim, mənə** (az da olsa) **nazil edəcəyin xeyrə** (ruziyə) **həqiqətən, möhtacam.** (Şüeybin qızları həmişəki vaxtlarından tez heyvanlarını suvarıb, özləri də şad- xürrəm evlərinə getdilər, Şüeyb soruşdu ki, bu gün nə tez gəldiniz? Dedilər: "Saleh bir şəxsi orada gördük, bizə mərhəmət edib heyvanlarımızı suvardı. Bu səbəbdən tez gəldik. Necə ki sıradakı ayədə xəbər verir, Şüeyb qızlarından birinə əmr etdi ki, get, o kişini mənim yanıma gətir)**.**

**25)** (فَجَاءَتْهُ اِحْدٰيهُمَا تَمْشِي عَلَى اسْتِحْيَاءٍ) **-** (Şüeybin qızlarından) **biri utana-utana** (atasının əmrilə heyvanıyla yola çıxan Musaya) **tərəf gəldi,** (قَالَتْ اِنَّ اَبِي يَدْعُوكَ لِيَجْزِيَكَ اَجْرَ مَا سَقَيْتَ لَنَا) – (gəlib Musaya) **dedi: "Atam səni çağırır ki, bizdən ötrü** (heyvanları) **suvardığın üçün sənə mükafat versin."** (Şüeybin qızı qabaqda, Musa da onun dalınca yola düşdülər. Musa gördü ki, külək Şüeybin qızının libasını bədəninə yapışdırıb bədənini göstərir. Musa bundan xoşlanmayıb Şüeybin qızına dedi: "Sən yolu mənə göstərib arxamca gəl." Bu şəkildə gedib Şüeybin yanına çatdılar, Şüeybin əmri ilə yemək gətirdilər. Musa yeməkdən yeyib, Şüeybin soruşmasından sonra öz əhvalatını Şüeybə nəql elədi)**.** (فَلَمَّا جَاءَهُ وَقَصَّ عَلَيْهِ الْقَصَصَ) – (Musa Şüeybin) **yanına getdikdə öz xəbərlərini ona nəql etdi,** (قَالَ لَا تَخَفْ نَجَوْتَ مِنَ الْقَوْمِ الظَّالِمِينَ) – (Şüeyb) **dedi: "Heç də qorxma, zalım qövmdən nicat tapdın."**

**26)** (قَالَتْ اِحْدٰيهُمَا يَا اَبَتِ اسْتَأْجِرْهُ) – (Şüeybin qızlarından) **biri** (atasına) **dedi: "Ey atacan, bu kişini muzdla tut,** (belə ki, bizim qoyunlarımızı otarıb işlərimizi də görsün). (اِنَّ خَيْرَ مَنِ اسْتَأْجَرْتَ الْقَوِيُّ الْاَمِينُ) **- həqiqətən o, muzdla tutduqlarının ən qüvvətlisi və əmin olanıdır.** (O, həm qüvvətli, həm etibarlıdır. Şüeyb qızına dedi: "Onun güc və əminliyini hardan bilirsən?" Dedi: "Gücünü heyvanlarımızı suvarmasından, 10 nəfərin çəkə bildiyi su qabını o, özü tək çəkib heyvanlarımızı suvardı, əminliyini isə yolda gələrkən gördüm, mən qabaqda, o arxada gəlirdi, bir qədər gedəndən sonra mənə dedi: "Yolu mənə göstərib, sən mənim arxamca gəl")**.**

**27)** (قَالَ لِنِّي اُرِيدُ اَنْ اُنْكِحَكَ اِحْدَى ابْنَتَيَّ هَاتَيْنِ عَلَى اَنْ تَأْجُرَنِي ثَمَانِيَ حِجَجٍ) – (Şüeyb Musaya) **dedi: "İstəyirəm, qızlarımdan birini sənə ərə verim. Bu şərtlə ki,** (onun mehriyyəsi bu olsun ki,) **8 il mənə xidmət edəsən.** (فَاِنْ اَتْمَمْتَ عَشْرًا فَمِنْ عِنْدِكَ) **- əgər onu 10 ilə tamamlayıb çatdırsan, o, sənin öz tərəfindən** (bir

وَمَآ اُرِيدُ اَنْ اَشُقَّ عَلَيْكَ سَتَجِدُنِيٓ اِنْ شَآءَ اللّٰهُ مِنَ الصَّالِحِينَ ﴿٢٧﴾ قَالَ ذٰلِكَ بَيْنِي وَبَيْنَكَ اَيَّمَا
الْاَجَلَيْنِ قَضَيْتُ فَلَا عُدْوَانَ عَلَيَّ وَاللّٰهُ عَلٰى مَا نَقُولُ وَكِيلٌ ﴿٢٨﴾ فَلَمَّا قَضٰى مُوسَى الْاَجَلَ وَسَارَ
بِاَهْلِهٖٓ اٰنَسَ مِنْ جَانِبِ الطُّورِ نَارًا قَالَ لِاَهْلِهِ امْكُثُوٓا اِنِّيٓ اٰنَسْتُ نَارًا لَعَلِّيٓ اٰتِيكُمْ مِنْهَا بِخَبَرٍ اَوْ جَذْوَةٍ مِنَ
النَّارِ لَعَلَّكُمْ تَصْطَلُونَ ﴿٢٩﴾ فَلَمَّآ اَتٰيهَا نُودِيَ مِنْ شَاطِئِ الْوَادِ الْاَيْمَنِ فِي الْبُقْعَةِ الْمُبَارَكَةِ مِنَ الشَّجَرَةِ

---

lütf olar)**.** (وَمَا اُرِيدُ اَنْ اَشُقَّ عَلَيْكَ) – (on il şərti kəsməklə) **səni zəhmətə salıb** (artıq xidmət etdirmək) **istəmirəm.** (سَتَجِدُنِيٓ اِنْ شَآءَ اللّٰهُ مِنَ الصَّالِحِينَ) **- əgər Allah-Təala istəsə, saleh şəxslərdən olduğumu görərsən.”**

**28)** (قَالَ ذٰلِكَ بَيْنِي وَبَيْنَكَ) **- Musa dedi: “Bu** (şərt səninlə mənim) **aramda** (sabit və möhkəm olsun, heç birimiz bu şərtdən kənara çıxmayaq)**,** (اَيَّمَا الْاَجَلَيْنِ قَضَيْتُ فَلَا عُدْوَانَ عَلَيَّ) **- bu iki müddətin** (8, ya da 10 il) **hansını tamamlasam,** (ixtiyarı məndə olsun, 8 il də olsa, artığı istənib)**, mənə zülm olunmasın.** (وَاللّٰهُ عَلٰى مَا نَقُولُ وَكِيلٌ) **- Allah-Təala bizim** (hər ikimizin) **dediyimizə vəkildir** (şahiddir.” Bu şərtləri hər ikisi qəbul edib anlaşandan sonra Şüeyb Səfurə adlı qızını Musaya ərə verdi. Musa Şüeybin heyvanlarını otarıb mühafizə etməyə başladı. Şüeyb Musaya başı əyri bir ağac verdi. Həmin ağac Musadan ötrü peyğəmbərlik möcüzəsi oldu. Bir il sonra Musanın gözəl xidmətinə görə Şüeyb ona dedi: “Bu il mənim qoyunlarımdan hansı başı qara, bədəni ağ bala doğsa, dişi, ya da erkək olsa da, onu sənə bağışlayacağam.” O il Allah-Təalanın lütfü ilə Şüeybin qoyunlarının hamısı o şəkildə doğdu. Şüeyb də əhdinə sadiq qalıb hamısını Musaya bağışladı)**.**

**29)** (فَلَمَّا قَضٰى مُوسَى الْاَجَلَ وَسَارَ بِاَهْلِهٖٓ) **- Musa** (Şüeybə) **xidmətini** (10 ilə) **tamamlayıb ailəsi ilə birlikdə** (Misirə) **yola düşdü.** (Şüeyb Musaya yaxşılıq etdiyi kimi, Musa da ona 10 il xidmət etdi)**.** (اٰنَسَ مِنْ جَانِبِ الطُّورِ نَارًا)– (gecə yol əsnasında azıb, hava da soyuq olduğundan ona od lazım oldu, uzaqdan) **Tur dağı tərəfində bir od gördü,** (قَالَ لِاَهْلِهِ امْكُثُوٓا) **– ailəsinə dedi: “Siz** (burada mən gələnə kimi) **durun,** (اِنِّيٓ اٰنَسْتُ نَارًا) **–** (uzaqdan) **bir od gördüm,** (o tərəfə gedəcəyəm)**.** (لَعَلِّيٓ اٰتِيكُمْ مِنْهَا بِخَبَرٍ) **- bəlkə** (oradakı şəxslərdən yol haqqında) **sizə xəbər gətirim.** (Belə ki, yola bələd olub gedək)**.** (اَوْ جَذْوَةٍ مِنَ النَّارِ لَعَلَّكُمْ تَصْطَلُونَ) **– ya da** (yolu tapmayıb burada qalmalı olsaq)**, sizə bir parça od gətirim ki, qızınasınız,** (bu gecə vaxtı soyuq sizə təsir etməsin)**.”**

**30)** (فَلَمَّآ اَتٰيهَا نُودِيَ مِنْ شَاطِئِ الْوَادِ الْاَيْمَنِ فِي الْبُقْعَةِ الْمُبَارَكَةِ مِنَ الشَّجَرَةِ) – (Musa) **gedib oda çatdıqda,** (gördü təzə bir ağac alovlanıb yanır, amma od ağaca heç təsir etmir, Musa çaşqın qalıb baxırdı, axırda çölün ot-ələfindən bir qədər toplayıb ağacın başındakı oda tərəf apardı ki, od götürüb ailəsinə aparsın. Bir də gördü ki, od yuxarıya qalxır, Musanın təəccübü daha da artdı, o əsnada) **vadinin sağ tərəfindəki o bərəkətli yerdəki ağacdan səs gəlib** (Musanı ça-

اَنْ يَا مُوسٰىٓ اِنّٖيٓ اَنَا اللّٰهُ رَبُّ الْعَالَمٖينَۙ ﴿٣٠﴾ وَاَنْ اَلْقِ عَصَاكَۜ فَلَمَّا رَاٰهَا تَهْتَزُّ كَاَنَّهَا جَآنٌّ وَلّٰى مُدْبِرًا
وَلَمْ يُعَقِّبْۜ يَا مُوسٰىٓ اَقْبِلْ وَلَا تَخَفْ۠ اِنَّكَ مِنَ الْاٰمِنٖينَ ﴿٣١﴾ اُسْلُكْ يَدَكَ فٖي جَيْبِكَ تَخْرُجْ بَيْضَآءَ
مِنْ غَيْرِ سُوٓءٍۘ وَاضْمُمْ اِلَيْكَ جَنَاحَكَ مِنَ الرَّهْبِ فَذَانِكَ بُرْهَانَانِ مِنْ رَبِّكَ اِلٰى فِرْعَوْنَ وَمَلَا۬ئِهٖۜ اِنَّهُمْ
كَانُوا قَوْمًا فَاسِقٖينَ ﴿٣٢﴾ قَالَ رَبِّ اِنّٖي قَتَلْتُ مِنْهُمْ نَفْسًا فَاَخَافُ اَنْ يَقْتُلُونِ ﴿٣٣﴾ وَاَخٖي هٰرُونُ
هُوَ اَفْصَحُ مِنّٖي لِسَانًا فَاَرْسِلْهُ مَعِيَ رِدْءًا يُصَدِّقُنٖيٓ اِنّٖيٓ اَخَافُ اَنْ يُكَذِّبُونِ ﴿٣٤﴾ قَالَ سَنَشُدُّ عَضُدَكَ
بِاَخٖيكَ

---

ğırdılar). (اَنْ يَا مُوسٰى اِنّٖي اَنَا اللّٰهُ رَبُّ الْعَالَمٖينَ) - (çağıran Allah-Təala olub buyurdu:) **"Ey Musa, həqiqətən, aləmlərə tərbiyə verən rəbb Allah-Təala mənəm.**

**31)** (وَاَنْ اَلْقِ عَصَاكَ) – (ey Musa), **əlindəki əsanı at",** (Musa əsanı yerə atdıqda, əsanın qorxunc bir böyük əjdəha olub sürətlə hərəkət etdiyini gördü), (فَلَمَّا رَاٰهَا تَهْتَزُّ كَاَنَّهَا جَآنٌّ وَلّٰى مُدْبِرًا وَلَمْ يُعَقِّبْ) – (Musa əjdəhanın) **ilan kimi hərəkət etdiyini gördükdə,** (qorxusundan) **dönüb qaçdı, heç arxaya da baxmadı.** (يَا مُوسٰى اَقْبِلْ وَلَا تَخَفْ اِنَّكَ مِنَ الْاٰمِنٖينَ) – (Allah-Təala Musaya dedi:) **"Ey Musa, bəri gəl, qorxma, həqiqətən, sən** (bizim yanımızda) **əmin olanlardansan.** (Musa qayıdıb Allah-Təalanın əmriylə əjdəhanı tutdu, o da əsa oldu).

**32)** (اُسْلُكْ يَدَكَ فٖي جَيْبِكَ تَخْرُجْ بَيْضَاءَ مِنْ غَيْرِ سُوءٍ) – (ey Musa), **əlini qoynuna sal, əlin** (oradan baras ağlığı kimi yox, şimşək parlaqlığı kimi) **qüsursuz ağappaq çıxsın.** (Musa Allah-Təalanın əmriylə əlini qoynuna salıb çıxaranda əli şimşək kimi gözləri nurlandıran şəkildə ağappaq oldu). (وَاضْمُمْ اِلَيْكَ جَنَاحَكَ مِنَ الرَّهْبِ) - (ey Musa, əsanın əjdəha olduğunu və qoynundan çıxartdığın əlinin şimşək kimi parlaq olduğunu gördükdə), **əlini öz** (qəlbinə) **tərəf qoy ki, qorxun çəkilsin.** (فَذَانِكَ بُرْهَانَانِ مِنْ رَبِّكَ اِلٰى فِرْعَوْنَ وَمَلَا۬ئِهٖ) - **bu iki şey** (əsanın əjdəha olması və əlinin qoynundan ağappaq çıxması) **rəbbin Allah-Təaladan** (sənin haqq olduğuna dair) **firon və əyanları üçün dəlildir,** (get onları dəvət et). (اِنَّهُمْ كَانُوا قَوْمًا فَاسِقٖينَ) - **həqiqətən, onlar fasiq bir camaatdırlar."**

**33)** (قَالَ رَبِّ اِنّٖي قَتَلْتُ مِنْهُمْ نَفْسًا فَاَخَافُ اَنْ يَقْتُلُونِ) – (Musa) **dedi: "Ey mənim rəbbim, həqiqətən, mən** (fironun qövmündən) **bir nəfəri qətlə yetirmişəm.** (Əgər indi gedib onları dəvət etsəm), **qorxuram ki, məni qətlə yetirsinlər.**

**34)** (وَاَخٖي هٰرُونُ هُوَ اَفْصَحُ مِنّٖي لِسَانًا) - **qardaşım Harun dil** (danışıq) **baxımından məndən fəsihdir.** (فَاَرْسِلْهُ مَعِيَ رِدْءًا يُصَدِّقُنٖي اِنّٖيٓ اَخَافُ اَنْ يُكَذِّبُونِ) - (Harunu) **mənimlə göndər ki, məni təsdiq etsin, həqiqətən, qorxuram ki, məni təkzib etsinlər.**

**35)** (قَالَ سَنَشُدُّ عَضُدَكَ بِاَخٖيكَ) – (Allah-Təala Musanın cavabında) **buyurdu: "Əlbəttə, sənin bazularını** (arxanı sənə kömək edən) **qardaşın** (Harunla)

وَنَجْعَلُ لَكُمَا سُلْطَانًا فَلَا يَصِلُونَ اِلَيْكُمَا بِاٰيَاتِنَاۚ اَنْتُمَا وَمَنِ اتَّبَعَكُمَا الْغَالِبُونَ ﴿٣٥﴾ فَلَمَّا جَاۤءَهُمْ
مُوسٰى بِاٰيَاتِنَا بَيِّنَاتٍ قَالُوا مَا هٰذَاۤ اِلَّا سِحْرٌ مُفْتَرًى وَمَا سَمِعْنَا بِهٰذَا فٖۤي اٰبَاۤئِنَا الْاَوَّلٖينَ ﴿٣٦﴾ وَقَالَ
مُوسٰى رَبّٖۤي اَعْلَمُ بِمَنْ جَاۤءَ بِالْهُدٰى مِنْ عِنْدِهٖ وَمَنْ تَكُونُ لَهُ عَاقِبَةُ الدَّارِۜ اِنَّهُ لَا يُفْلِحُ الظَّالِمُونَ
﴿٣٧﴾ وَقَالَ فِرْعَوْنُ يَاۤ اَيُّهَا الْمَلَاُ مَا عَلِمْتُ لَكُمْ مِنْ اِلٰهٍ غَيْرٖيۚ

---

**möhkəmlədəcəyik.** (وَنَجْعَلُ لَكُمَا سُلْطَانًا) **- və sizə** (düşmənə qalib gəlmə) **gücü verəcəyik.** (فَلَا يَصِلُونَ اِلَيْكُمَا) – (firon və onun qövmü) **sizə heç bir pislik** (əziyyət) **edə bilməzlər.** (بِاٰيَاتِنَا) – (sən və qardaşın Harun bizim sizə bəxş etdiyimiz) **möcüzələrimizlə** (gedib fironu və qövmünü dəvət edin)**.** (اَنْتُمَا وَمَنِ اتَّبَعَكُمَا الْغَالِبُونَ) **– siz və sizə tabe olanlar** (firona və onun qövmünə) **mütləq qalib gələcəksiniz.”**

**36)** (فَلَمَّا جَاۤءَهُمْ مُوسٰى بِاٰيَاتِنَا بَيِّنَاتٍ) **– Musa açıq-aşkar möcüzələrimizlə** (fironun və onun qövmünün) **yanına gəlib** (dəvət etdikdə)**,** (قَالُوا مَا هٰذَاۤ اِلَّا سِحْرٌ مُفْتَرًى) **- dedilər: “**(ey Musa)**, bu, sənin** (Allah-Təalaya) **iftira atıb uydurduğun sehrdən başqa bir şey deyil,** (özün edib, yalandan - Allah-Təala bunu mənə möcüzə verib, deyirsən)**.** (وَمَا سَمِعْنَا بِهٰذَا فٖۤي اٰبَاۤئِنَا الْاَوَّلٖينَ) **– keçmiş ata-babalarımızdan belə bir şeyin** (olduğunu) **eşitməmişik.** (Qibtilərin bu sözləri onların Musanın qarşısında məğlub olduqlarına dəlildir, çünki Musanın möcüzələrini sehr saymaq onların aciz qaldığına dəlildir, necə ki Məkkə əhli Hz. Peyğəmbərin müqabilində aciz qalıb, dəlil tapmayıb onun gətirdiyi vəhyi sehr saydılar, əks-təqdirdə Musanın əsasının və ağappaq əlinin müqabilində daha böyük bir şey, Qurani-Şərifin müqabilində də daha gözəl kəlam gətirib onları batil etməliydilər. Buna qadir olmadıqlarından sehr adlandırdılar, bu isə səfehlikdir)**.**

**37)** (وَقَالَ مُوسٰى رَبّٖۤي اَعْلَمُ بِمَنْ جَاۤءَ بِالْهُدٰى مِنْ عِنْدِهٖ) **- Musa dedi: “Mənim rəbbim Allah-Təala öz dərgahından kimin hidayət gətirdiyini bilir,** (وَمَنْ تَكُونُ لَهُ عَاقِبَةُ الدَّارِ) **- və** (gözəl aqibətin)**, axirət yurdunun kimə qismət olacağını da** (bilir. Mənə deyirsiniz ki, Allah-Təalaya iftira edib yalan deyirəm. Allah-Təala özü mənim yalan, yoxsa doğru dediyimi bilir. Siz bu sözü deməklə zalımlardan oldunuz)**.** (اِنَّهُ لَا يُفْلِحُ الظَّالِمُونَ) **- həqiqətən, zalım şəxslər nicat tapmazlar.”**

**38)** (وَقَالَ فِرْعَوْنُ يَاۤ اَيُّهَا الْمَلَاُ مَا عَلِمْتُ لَكُمْ مِنْ اِلٰهٍ غَيْرٖي) **-** (Musa fironu və onun qövmünü ciddi-cəhdlə Allah-Təalaya tərəf dəvət edib, Allah-Təala tərəfindən gətirdiyi möcüzələri onlara göstərdikdə firon aciz qalıb, vəzirlərinə xitab edib) **dedi: “Ey mənim əyanlarım, mən sizdən ötrü özümdən başqa bir məbud bilmirəm.”** (Musanın sözləri qəbul olan söz deyil. Deyir ki, mənim böyük bir məbudum var. Onun məbudunu tanımaq istəyirəm. O isə deyir: “Mənim məbudum görünməyəndir.” Yəqin onun məbudu səmadadır. Lakin Musa heç

فَاَوْقِدْ لِي يَا هَامَانُ عَلَى الطِّينِ فَاجْعَلْ لِي صَرْحًا لَعَلِّيَ اَطَّلِعُ اِلَىٰ اِلٰهِ مُوسٰى وَاِنِّي لَاَظُنُّهُ مِنَ الْكَاذِبِينَ ﴿٣٨﴾

---

vaxt demədi ki, mənim məbudum səmadadır, firon öz xəyalıyla belə söz dedi. Ondan sonra bir qüllə düzəltməyi əmr etdi. Ta ki, bəlkə, o qüllədən Musanın məbudundan xəbərdar olsun)**.** (فَاَوْقِدْ لِي يَا هَامَانُ عَلَى الطِّينِ) – (firon vəziri Hamana əmr edib dedi:) **ey Haman, mənim üçün palçığın üzərində od yandır** (ki, palçıq bişib kərpic olsun. Misirdə ilk bişmiş kərpici ixtira edən Musanın fironu olubdur. Necə ki bu ayədən belə məlum olur)**.** (فَاجْعَلْ لِي صَرْحًا لَعَلِّي اَطَّلِعُ اِلٰى اِلٰهِ مُوسٰى) – (o kərpicdən) **mənim üçün** (uca) **bir qüllə tik ki,** (o qüllənin üstünə çıxıb) **Musanın* tanrısından xəbərdar olum.** (وَاِنِّي لَاَظُنُّهُ مِنَ الْكَاذِبِينَ) **- həqiqətən,** (Musanın - yerin və səmaların xaliqi yeganə Allah-Təaladır, sözündə) **yalançılardan olduğunu güman edirəm.”**

*(***Qeyd:** Firon və onun vəzirlərinin cəhalət və qəbahətinin çoxluğuna bundan artıq nə dəlil ola bilər ki, öz tikdikləri qüllə ilə aləmlərin xaliqindən xəbərdar olub, Onun necəliyini bilmək istəyirlər. Görəsən, firon öz vəzirlərinə və xalqına istehza edib, onların axmaqlığına gülüb, Musaya onların heyvanlığını göstərmək üçün belə bir əmri verdi? Yəni onlardan bir deyən yoxdur ki, bu qüllənin üstündə nə var ki, oradan Musanın Allahına agah olasan? Ey Musa, belə camaatdan sən nə gözləyirsən? Buna oxşar müxtəsər bir hekayə nəql edək, ariflərdən bir nəfər Şama getdi, küçədə, bazarda gəzib, əlində yemək və meyvə yeyirdi, onu tanıyan şəxslər ona dedilər: “Bazar içində gəzib, yemək yemək insanlığa ziddir”, -o arif şəxs dedi: “Sən elə xəyal edirsən ki, bu məxluqlar insandır? Bunların hamısı öküzdür, indi sənə bunu sübut edərəm.” Gedib bir meydanda dayanıb başladı hədis danışmağa. Elə ki camaat çoxaldı, o, dedi: “Camaat, filankəs filankəsdən, o da filankəsdən (hər bir ravini bir adla zikr etdi), o da Hz. Peyğəmbərdən rəvayət edib deyir: Hz. Peyğəmbər buyurubdur: “Kimin dilinin ucu burnunun ucuna dəysə, o şəxs cənnət əhlidir.” O şəxs bu sözü deyəndən sonra yanındakı şəxsə dedi: “Bax.” O da baxıb gördü ki, orada duran yüzlərlə məxluqun hamısı dillərini çıxardıb burunlarının ucuna toxundurmağa çalışırlar.” Bir-biriləri ilə də mübahisə edirlər. Biri deyir: “Mənim dilim dəydi”, o birisi deyir: “Səninki dəymədi, mənimki dəydi”, böyük bir qalmaqal başladı. O şəxs onları o halda qoyub yola düşdü. Ona irad edən şəxsə dedi: “Gördün, bunlar öküzdür, insan deyil. Camaatın arasında bir nəfər tapılmadı ki, mənə desin ki, ey Allah-Təalanın düşməni, yalan deyirsən, peyğəmbərə iftira atırsan.” Müəllif deyir: “Bizim bu zəmanəmiz o zamandan betərdir. Bizim din və məzhəbimiz yalan sözlər üzərinə qurulub və Allah-Təalanın və onun peyğəmbərinin doğru sözləri unudulub, yalan sözlər rəvac tapıbdır. Haqqı deyən, doğru danışan şəxslər camaatın arasında nahaq və yalançı sayılıblar. Bidətçilərin icad etdiyi sözlər, bidətlər xalqı asi edib elə zəlalətə salıb ki, o zəlalətdən qurtulmaq müşkül olubdur. Qurani-Şərifin əmr və qadağasını deyən şəxsi qəbul etməyib, o bidət sözlərə yapışırlar. Küçə və bazarlarda, məclislərdə ucuz qiymətə cənnət satan şəxslərə aldanıb Şam əhli kimi dillərini burunlarına dəydirməklə cənnəti*

وَاسْتَكْبَرَ هُوَ وَجُنُودُهُ فِي الْاَرْضِ بِغَيْرِ الْحَقِّ وَظَنُّوٓا اَنَّهُمْ اِلَيْنَا لَا يُرْجَعُونَ ﴿٣٩﴾ فَاَخَذْنَاهُ وَجُنُودَهُ
فَنَبَذْنَاهُمْ فِي الْيَمِّۚ فَانْظُرْ كَيْفَ كَانَ عَاقِبَةُ الظَّالِمِينَ ﴿٤٠﴾ وَجَعَلْنَاهُمْ اَئِمَّةً يَدْعُونَ اِلَى النَّارِۚ وَيَوْمَ
الْقِيٰمَةِ لَا يُنْصَرُونَ ﴿٤١﴾ وَاَتْبَعْنَاهُمْ فِي هٰذِهِ الدُّنْيَا لَعْنَةًۚ وَيَوْمَ الْقِيٰمَةِ هُمْ مِنَ الْمَقْبُوحِينَ ﴿٤٢﴾
وَلَقَدْ اٰتَيْنَا مُوسَى الْكِتَابَ مِنْ بَعْدِ مَآ اَهْلَكْنَا الْقُرُونَ الْاُولٰى بَصَٓائِرَ لِلنَّاسِ وَهُدًى وَرَحْمَةً لَعَلَّهُمْ
يَتَذَكَّرُونَ ﴿٤٣﴾ وَمَا كُنْتَ بِجَانِبِ الْغَرْبِيِّ اِذْ قَضَيْنَٓا اِلٰى مُوسَى الْاَمْرَ وَمَا كُنْتَ مِنَ الشَّاهِدِينَۙ ﴿٤٤﴾

---

*əldə etdiklərini hesab edirlər. İlahi, nə pis zəmanəyə düçar olduq. Sən özün mədəd et! Keçək əsl mətləbimizə, görəsən, firon camaata istehza etməkdən ötrü belə hündür qüllə tikdi? Yoxsa, həqiqətən özü də onlar kimi cahil və axmaq idi? Ola bilər ki, belə də olsun. Çünki əgər firon ağıllı olsaydı, belə bir qəbih və ağla zidd əməl etməzdi. İnsanın cəhaləti artmasa, belə axmaq əməllər etməz)*

**39)** (وَاسْتَكْبَرَ هُوَ وَجُنُودُهُ فِي الْاَرْضِ بِغَيْرِ الْحَقِّ) – (firon və onun qoşunu) **haqları olmadığı halda,** (Misir) **torpağında təkəbbürlənib** (Allah-Təalaya itaət etmədilər). (وَظَنُّوا اَنَّهُمْ اِلَيْنَا لَا يُرْجَعُونَ) – **onlar belə zənn etdilər ki, bizim tərəfimizə qayıtmayacaqlar,** (qiyamət günü olmayıb, haqq-hesaba çəkilməyəcəklər).

**40)** (فَاَخَذْنَاهُ وَجُنُودَهُ) - **fironun özünü və qoşununu tutduq,** (bizdən qurtula bilmədilər). (فَنَبَذْنَاهُمْ فِي الْيَمِّ) – (onları tutandan sonra fironun özünü və qoşununu) **dənizə atıb** (qərq etdik). (فَانْظُرْ كَيْفَ كَانَ عَاقِبَةُ الظَّالِمِينَ) - (ey Məhəmməd), **bax, gör ki, zalımların aqibəti necə oldu,** (hamısını dənizə qərq edib həlak etdik).

**41)** (وَجَعَلْنَاهُمْ اَئِمَّةً يَدْعُونَ اِلَى النَّارِ) – (firon və ona tabe olanları cəhənnəm) **oduna tərəf dəvət edən rəhbərlər etdik.** (وَيَوْمَ الْقِيٰمَةِ لَا يُنْصَرُونَ) - (necə ki cənnətə dəvət edən rəhbərlərə kömək olunur, cəhənnəmə dəvət edən rəhbərlərə) **qiyamət günü kömək olunmaz.**

**42)** (وَاَتْبَعْنَاهُمْ فِي هٰذِهِ الدُّنْيَا لَعْنَةً) - (ey Məhəmməd, firon və qövmünü rəhmətimizdən uzaq tutub), **bu dünyada onlara lənət etdik.** (وَيَوْمَ الْقِيٰمَةِ هُمْ مِنَ الْمَقْبُوحِينَ) **- qiyamət günündə də** (üzləri qaralanlardan) **çirkinləşənlərdən olub,** (Allah-Təalanın rəhmətindən uzaq və əzab içində olarlar).

**43)** (وَلَقَدْ اٰتَيْنَا مُوسَى الْكِتَابَ مِنْ بَعْدِ مَٓا اَهْلَكْنَا الْقُرُونَ الْاُولٰى) – **əvvəlki nəsilləri** (Nuh, Ad, Səmud camaatlarını) **həlak edəndən sonra Musaya Tövratı verdik.** (بَصَٓائِرَ لِلنَّاسِ) – (belə ki,) **insanlar üçün bir nur olsun,** (وَهُدًى وَرَحْمَةً) – (Tövrata iman gətirib əməl edənlərdən ötrü onu) **hidayət və rəhmət** (etdik). (لَعَلَّهُمْ يَتَذَكَّرُونَ) – **bəlkə** (onun öyüd-nəsihətlərini) **düşünüb, ibrət alıb,** (imana daxil olsunlar).

**44)** (وَمَا كُنْتَ بِجَانِبِ الْغَرْبِيِّ اِذْ قَضَيْنَٓا اِلٰى مُوسَى الْاَمْرَ) - (ey Məhəmməd), **biz Musaya** (Tövratın vəhyini) **əmr etdiyimiz zaman sən** (Turi-Sinanın) **qərb tərəfində deyildin.** (وَمَا كُنْتَ مِنَ الشَّاهِدِينَ) - (ey Məhəmməd, Musa öz qövmündən 70

وَلٰكِنَّٓا اَنْشَأْنَا قُرُونًا فَتَطَاوَلَ عَلَيْهِمُ الْعُمُرُۚ وَمَا كُنْتَ ثَاوِيًا فِٓي اَهْلِ مَدْيَنَ تَتْلُوا عَلَيْهِمْ اٰيَاتِنَاۙ وَلٰكِنَّا كُنَّا
مُرْسِلِينَ ﴿٤٥﴾ وَمَا كُنْتَ بِجَانِبِ الطُّورِ اِذْ نَادَيْنَا وَلٰكِنْ رَحْمَةً مِنْ رَبِّكَ لِتُنْذِرَ قَوْمًا مَٓا اَتٰيهُمْ مِنْ
نَذِيرٍ مِنْ قَبْلِكَ لَعَلَّهُمْ يَتَذَكَّرُونَ ﴿٤٦﴾ وَلَوْلَٓا اَنْ تُصِيبَهُمْ مُصِيبَةٌ بِمَا قَدَّمَتْ اَيْدِيهِمْ فَيَقُولُوا رَبَّنَا
لَوْلَٓا اَرْسَلْتَ اِلَيْنَا رَسُولًا فَنَتَّبِعَ اٰيَاتِكَ وَنَكُونَ مِنَ الْمُؤْمِنِينَ ﴿٤٧﴾

---

nəfəri seçib özüylə Turi-Sinaya aparanda da) **sən onlara şahid olanlardan deyildin.** (Belə ki, Musaya Tövratın nazil olduğunu görüb ona gələn vəhydən xəbərdar olasan. Bəs bunları necə bilib camaata çatdırırsan? Bunları sənə bildirən ancaq Allah-Təaladır)**.**

**45)** (وَلٰكِنَّٓا اَنْشَأْنَا قُرُونًا) **– lakin** (ey Məhəmməd, Musaya vəhy göndərəndən sənin dövrünə kimi) **çox nəsillər yaratdıq.** (فَتَطَاوَلَ عَلَيْهِمُ الْعُمُرُ) – (ey Məhəmməd, o ümmətlərin) **üzərindən** (sənin ümmətinə qədər vəhyin gəlməsi üçün) **çox uzun ömürlər** (zaman) **keçdi.** (Ey Məhəmməd, elm unudulub cəhalət rəvac tapdığından səni göndərmək zəruri oldu. Səni göndərib, hər bir elmi, hikməti, o cümlədən peyğəmbərlərin qissələrini sənə nəql etdik. Sən o qissələrə özündən agah deyilsən, bəs niyə Qüreyş camaatı sənə inanmır?) (وَمَا كُنْتَ ثَاوِيًا فِٓي اَهْلِ مَدْيَنَ) - (ey Məhəmməd)**, sən** (Şüeybin qövmü olan) **Mədyən camaatının da arasında deyildin.** (تَتْلُوا عَلَيْهِمْ اٰيَاتِنَا) – (ki, onlardan Şüeyb və Musa barəsində, ya Şüeyblə öz qövmünün barəsində Qurani-Şərifdə nazil olan) **ayələri oxuyub** (öyrənəsən)**.** (وَلٰكِنَّا كُنَّا مُرْسِلِينَ) **- lakin səni göndərib** (o qissələri sənə öyrədən) **bizik.**

**46)** (وَمَا كُنْتَ بِجَانِبِ الطُّورِ اِذْ نَادَيْنَا) **-** (ey Məhəmməd)**, biz** (Musanı) **çağırıb** (ona peyğəmbərlik verib firona göndərdiyimiz zaman) **sən** (Tur dağının) **yanında deyildin,** (وَلٰكِنْ رَحْمَةً مِنْ رَبِّكَ) **- lakin rəbbin Allah-Təaladan bir rəhmət olaraq** (səni peyğəmbər göndərib, bu xəbərləri öyrətdi)**.** (لِتُنْذِرَ قَوْمًا مَٓا اَتٰيهُمْ مِنْ نَذِيرٍ مِنْ قَبْلِكَ) **- ki, səndən əvvəl özlərinə** (İsadan sonra) **bir peyğəmbər gəlməyən qövmü** (Qüreyşi) **qorxudasan.** (لَعَلَّهُمْ يَتَذَكَّرُونَ) **– bəlkə** (müşriklər bu qissələrdə olan) **öyüd-nəsihəti qəbul edib,** (şirki tərk edib müvəhhid olsunlar)**.**

**47)** (وَلَوْلَٓا اَنْ تُصِيبَهُمْ مُصِيبَةٌ بِمَا قَدَّمَتْ اَيْدِيهِمْ فَيَقُولُوا) – (bu müşriklər) **öz əlləri ilə etdikləri** (əvvəlcədən göndərdikləri şirk) **əməlləri səbəbilə müsibətə düçar olub** (qiyamət günündə əzaba məruz qalanda) **bizə belə deməsinlər deyə,** (رَبَّنَا لَوْلَٓا اَرْسَلْتَ اِلَيْنَا رَسُولًا) **- ey bizim rəbbimiz, niyə bizə bir peyğəmbər göndərmədin?** (فَنَتَّبِعَ اٰيَاتِكَ وَنَكُونَ مِنَ الْمُؤْمِنِينَ) **- belə ki, biz də sənin ayə və möcüzələrinə tabe olub möminlərdən olaydıq.** (Ey Məhəmməd, əgər müşriklər qiyamət günündə bizə belə deməsəydilər, heç bir peyğəmbər göndərməzdik. Çünki peyğəmbər göndərməsəydik, qiyamət günündə bizə irad tutacaqdılar, o səbəbdən peyğəmbərlər göndərdik ki, bəhanələri qalmasın)**.**

فَلَمَّا جَآءَهُمُ الْحَقُّ مِنْ عِنْدِنَا قَالُوا لَوْلَآ اُوتِيَ مِثْلَ مَآ اُوتِيَ مُوسٰىٓ اَوَلَمْ يَكْفُرُوا بِمَآ اُوتِيَ مُوسٰى مِنْ قَبْلُۚ قَالُوا سِحْرَانِ تَظَاهَرَاۚ وَقَالُوٓا اِنَّا بِكُلٍّ كَافِرُونَ ﴿٤٨﴾ قُلْ فَأْتُوا بِكِتَابٍ مِنْ عِنْدِ اللّٰهِ هُوَ اَهْدٰى مِنْهُمَآ اَتَّبِعْهُ اِنْ كُنْتُمْ صَادِقِينَ ﴿٤٩﴾ فَاِنْ لَمْ يَسْتَجِيبُوا لَكَ فَاعْلَمْ اَنَّمَا يَتَّبِعُونَ اَهْوَآءَهُمْ

---

**48)** (فَلَمَّا جَآءَهُمُ الْحَقُّ مِنْ عِنْدِنَا) – **lakin** (Məkkə müşriklərinə) **bizim tərəfimizdən haqq** (peyğəmbər Hz. Məhəmməd və Quran) **gəldikdə,** (bəhanələri kəsildi. Qurani-Şərifi batil etmək üçün bir dəlil tapmayıb məəttəl qaldılar, boş-boş sözlər danışmağa başladılar)**.** (قَالُوا لَوْلَآ اُوتِيَ مِثْلَ مَآ اُوتِيَ مُوسٰى) – **dedilər:** (əgər bu Məhəmməd haqq peyğəmbərdirsə)**, niyə Musaya verilən** (möcüzələrin) **misli ona da verilmir?** (Belə ki, haqq peyğəmbər sayılsın)**.** (اَوَلَمْ يَكْفُرُوا بِمَآ اُوتِيَ مُوسٰى مِنْ قَبْلُ) - (Allah-Təala onların cavabında buyurur:) **bəs bundan əvvəl Musaya verilən** (möcüzələri) **inkar etmədilər?** (Ey Məhəmməd, sənə də möcüzə versəydik, onların inkar etməsi kimi bu müşriklər* də səni inkar edərdilər)**.** (قَالُوا سِحْرَانِ تَظَاهَرَا) – (necə ki Musa və Harunun etdiklərinin) **hər iki-si - bir-birinə kömək edən sehrdir, demişdilər,** (sehrin adını möcüzə qoyub bizə göstərirlər)**.** (وَقَالُوٓا اِنَّا بِكُلٍّ كَافِرُونَ) – **və dedilər: biz** (Musa və Harunun) **hər ikisini inkar etdik.**

*(*Qeyd:** Bu ayə işarə edir ki, Allah-Təala Hz. Peyğəmbərdən istənilən möcüzələri ona bəxş etməyib və o cənab heç bir möcüzə göstərməyibdir. Amma İslam ümməti peyğəmbərlərinin təəssübünü çəkib onun ən fəzilətli peyğəmbər olduğunu göstərməkdən ötrü kitablar yazıb, bütün keçmiş peyğəmbərlərin möcüzələrini o kitablarda qeyd edib, Allah-Təalanın kitabını təkzib edərək o möcüzələri Hz. Peyğəmbərə də isnad edirlər. Qurani-Şərifin təkzib etdiyi möcüzələri onlar təsdiq edib, nəinki Hz. Peyğəmbərə, hətta onun varislərinə, xəlifələrinə və sair övliyalara da bunları isnad edirlər. Allah-Təalanın kitabını bundan da artıq təhrif edib dəyişdirmək olarmı? Bu möcüzələrin Hz. Peyğəmbərə aid olmaması haqda Qurani-Şərifin açıq-aydın ayələrini dəlil göstərəndə, bəzi-bəzi mollaların və digərlərinin kitablarında yazılan uydurma rəvayətləri dəlil gətirib Qurani-Şərifin ayələrini tərk edirlər, bundan da böyük bəla olarmı?)*

**49)** (قُلْ فَأْتُوا بِكِتَابٍ مِنْ عِنْدِ اللّٰهِ) - (ey Məhəmməd, müşriklərə) **de ki, Allah-Təala tərəfindən elə bir kitab gətirin ki,** (هُوَ اَهْدٰى مِنْهُمَآ اَتَّبِعْهُ) - (Quran və Tövratdan da) **artıq hidayət edən olsun,** (o zaman təsdiq edib) **mən də ona tabe olaram.** (اِنْ كُنْتُمْ صَادِقِينَ) – (bu kitabların Allah-Təala tərəfindən gəlməməsi haqda) **əgər doğru deyirsinizsə,** (siz də bir kitab gətirin)**.**

**50)** (فَاِنْ لَمْ يَسْتَجِيبُوا لَكَ) – (ey Məhəmməd)**, əgər sənə cavab verməyib** (sözünü qəbul etməyib, istədiyin kitabı gətirməsələr, hansı ki gətirə də bilməyəcəklər)**,** (فَاعْلَمْ اَنَّمَا يَتَّبِعُونَ اَهْوَآءَهُمْ) **- o vaxt bil ki,** (onların küfr və zəlalətə tabe olmalarında heç bir dəlil və sübutları olmayıb)**, öz nəfslərinə tabe olurlar.**

وَمَنْ اَضَلُّ مِمَّنِ اتَّبَعَ هَوٰيهُ بِغَيْرِ هُدًى مِنَ اللّٰهِۜ اِنَّ اللّٰهَ لَا يَهْدِي الْقَوْمَ الظَّالِمِينَ ﴿٥٠﴾ وَلَقَدْ وَصَّلْنَا
لَهُمُ الْقَوْلَ لَعَلَّهُمْ يَتَذَكَّرُونَۜ ﴿٥١﴾ اَلَّذِينَ اٰتَيْنَاهُمُ الْكِتَابَ مِنْ قَبْلِه۪ هُمْ بِه۪ يُؤْمِنُونَ ﴿٥٢﴾ وَاِذَا يُتْلٰى
عَلَيْهِمْ قَالُوٓا اٰمَنَّا بِه۪ٓ اِنَّهُ الْحَقُّ مِنْ رَبِّنَٓا اِنَّا كُنَّا مِنْ قَبْلِه۪ مُسْلِمِينَ ﴿٥٣﴾ اُو۬لٰٓئِكَ يُؤْتَوْنَ اَجْرَهُمْ مَرَّتَيْنِ
بِمَا صَبَرُوا وَيَدْرَؤُنَ بِالْحَسَنَةِ السَّيِّئَةَ وَمِمَّا رَزَقْنَاهُمْ يُنْفِقُونَ ﴿٥٤﴾ وَاِذَا سَمِعُوا اللَّغْوَ اَعْرَضُوا عَنْهُ
وَقَالُوا لَنَٓا اَعْمَالُنَا وَلَكُمْ اَعْمَالُكُمْۘ سَلَامٌ عَلَيْكُمْۘ

---

(وَمَنْ اَضَلُّ مِمَّنِ اتَّبَعَ هَوٰيهُ بِغَيْرِ هُدًى مِنَ اللّٰهِ) **- Allah-Təala tərəfindən bir hidayət olmayınca öz nəfsinə tabe olandan daha çox zəlalətə düşən kimdir?** (اِنَّ اللّٰهَ لَا يَهْدِي الْقَوْمَ الظَّالِمِينَ) **- həqiqətən, Allah-Təala zalım qövmə hidayət etməz,** (bir camaat ki, öz dini məsələlərində nəfsinə tabe olur, o camaata Allah-Təala hidayət edərmi?)

**51)** (وَلَقَدْ وَصَّلْنَا لَهُمُ الْقَوْلَ لَعَلَّهُمْ يَتَذَكَّرُونَ) **- həqiqətən,** (Quran ayələrində keçən peyğəmbərlər haqqındakı) **sözləri bir-birinin ardınca** (Qurani-Şərifdə nazil edib, müşriklərə) **təfsilatla bəyan etdik ki, bəlkə** (öz ixtiyarlarıyla) **öyüd-nəsihəti qəbul edib** (müvəhhid olsunlar)**.**

**52)** (اَلَّذِينَ اٰتَيْنَاهُمُ الْكِتَابَ مِنْ قَبْلِه۪ هُمْ بِه۪ يُؤْمِنُونَ) **-** (bu ayə Hz. Peyğəmbər Mədinəyə hicrət edəndən sonra kitab əhlindən müsəlman olanların haqqında əvvəlcədən Məkkədə nazil olmuşdu:) **özlərinə** (Qurandan) **əvvəl kitab** (Tövrat və İncil) **göndərdiyimiz şəxslər bu Qurana iman edirlər.** (Amma siz Məkkə müşrikləri bu Quran sizə nazil olduğu halda, ona iman gətirmirsiniz)**.**

**53)** (وَاِذَا يُتْلٰى عَلَيْهِمْ قَالُوٓا اٰمَنَّا بِه۪ٓ اِنَّهُ الْحَقُّ مِنْ رَبِّنَٓا) – (bu Quran kitab əhlindən iman gətirən şəxslərə) **oxunduqda, onlar deyərlər: "Biz** (Qurana) **iman gətirdik, həqiqətən də o, rəbbimizdən olan haqdır.** (اِنَّا كُنَّا مِنْ قَبْلِه۪ مُسْلِمِينَ) **- həqiqətən, biz** (bu Quran nazil olmadan) **əvvəl** (Allah-Təalaya) **itaət edib** (müvəhhid olanlardan idik. Bu Quran da tövhidi əmr etdiyindən ona da iman gətirib təsdiq edirik)**."**

**54)** (اُو۬لٰٓئِكَ يُؤْتَوْنَ اَجْرَهُمْ مَرَّتَيْنِ بِمَا صَبَرُوا) **-** (ey Məhəmməd, bu kitab əhlindən iman gətirənlərə digrə kitab əhlinin və müşriklərin əziyyətlərinə) **səbir etdiklərinə görə iki dəfə mükafat verilər.** (وَيَدْرَؤُنَ بِالْحَسَنَةِ السَّيِّئَةَ) – (kitab əhlindən iman gətirənlər onlara edilən) **pisliyi** (əziyyəti) **yaxşılıqla** (xoşluqla) **özlərindən dəf edərlər.** (وَمِمَّا رَزَقْنَاهُمْ يُنْفِقُونَ) **- və onlara verdiyimiz ruzilərdən** (bizim yolumuzda sərf edib) **ehsan edərlər.**

**55)** (وَاِذَا سَمِعُوا اللَّغْوَ اَعْرَضُوا عَنْهُ) – (kitab əhlindən iman gətirənlər kafir və müşriklərdən) **boş söz eşitdikdə, ondan üz döndərib** (yersiz cavab verməzlər)**.** (وَقَالُوا لَنَٓا اَعْمَالُنَا وَلَكُمْ اَعْمَالُكُمْ) – (onların cavabında belə) **deyərlər: "Bizim əməllərimiz bizə, sizin əməlləriniz sizə aiddir.** (سَلَامٌ عَلَيْكُمْ)**- bizim tərəfimiz-**

لَا نَبْتَغِي الْجَاهِلِينَ ﴿٥٥﴾ اِنَّكَ لَا تَهْدِي مَنْ اَحْبَبْتَ وَلٰكِنَّ اللّٰهَ يَهْدِي مَنْ يَشَاۤءُۚ وَهُوَ اَعْلَمُ بِالْمُهْتَدِينَ ﴿٥٦﴾ وَقَالُوٓا اِنْ نَتَّبِعِ الْهُدٰى مَعَكَ نُتَخَطَّفْ مِنْ اَرْضِنَاۜ اَوَلَمْ نُمَكِّنْ لَهُمْ حَرَمًا اٰمِنًا يُجْبٰٓى اِلَيْهِ ثَمَرَاتُ كُلِّ شَيْءٍ رِزْقًا مِنْ لَدُنَّا وَلٰكِنَّ اَكْثَرَهُمْ لَا يَعْلَمُونَ ﴿٥٧﴾

---

**dən salamat qalın.** (Biz sizə cavab verən deyilik)**.** (لَا نَبْتَغِي الْجَاهِلِينَ) **- biz** (sizin kimi) **cahillərlə** (oturub-durmaq) **istəmirik.”** (Burada Mədinədə iman gətirən kitab əhlinin sözü bitdi. Bu xəbər Hz. Peyğəmbərin doğruluğuna bir möcüzədir. Bu ayələr Məkkədə göndərilib, Mədinəyə hicrət edəndən sonra bu xəbər doğru çıxdı. Kitab əhlindən bu ayələrdə göstərilən xüsusiyyətlərdə olanlar Hz. Peyğəmbərə iman gətirdilər)**.**

**56)** (اِنَّكَ لَا تَهْدِي مَنْ اَحْبَبْتَ) - (ey Məhəmməd)**, hər* sevdiyinə hidayət edib** (islama daxil edə bilməzsən, bunu edə biləcəyini zənn edirsən?)

*(***Qeyd:*** Təfsirçilərdən Zəccac deyir: “İslam alimlərinin ittifaqı (icması) ilə bu ayə Əbu Talib haqqında nazil olubdur.”).*

(وَلٰكِنَّ اللّٰهَ يَهْدِي مَنْ يَشَاۤءُ) **- lakin Allah-Təala kimi istəsə,** (öz əməli səbəbilə ona) **hidayət edər.** (وَهُوَ اَعْلَمُ بِالْمُهْتَدِينَ) – (Allah-Təala) **hidayət üzrə olanlardan agahdır,** (sən isə agah ola bilməzsən, əbəs yerə özünə əziyyət verib layiq olmayan şəxslərin imana daxil olması üçün səy etmə)**.**

**57)** (وَقَالُوا اِنْ نَتَّبِعِ الْهُدٰى مَعَكَ نُتَخَطَّفْ مِنْ اَرْضِنَا) **-** (bu ayə Haris ibn Osman ibn Novfel ibn Əbdümanaf və ona tabe olanlar haqqında nazil olubdur, necə ki ayədə xəbər verir, Hz. Peyğəmbərə) **dedilər:** (biz bilirik ki, sən haqq və hər bir sözün haqdır, amma) **əgər biz səninlə birlikdə haqqa tabe olub** (sənin dininə girsək, sayımız az olduğundan müşriklərin əli ilə) **yurdumuzdan atılarıq,** (bundan qorxduğumuz üçün sənə iman gətirmirik)**.** (اَوَلَمْ نُمَكِّنْ لَهُمْ حَرَمًا اٰمِنًا) **-** (Allah-Təala onların cavabında buyurur: ey Məhəmməd, bu müşriklər islama girməmək üçün bəhanə gətirirlər)**, məgər biz onları əmin olan bu hərəmdə** (Məkkə və ətrafı) **yerləşdirmədikmi?** (Hansı ki onun ətrafında ərəblər bir-birilərini öldürüb qarət edirlər, Məkkə əhli isə bunlardan arxayın olub, onlara heç bir zərər toxunmur)**.** (يُجْبٰى اِلَيْهِ ثَمَرَاتُ كُلِّ شَيْءٍ رِزْقًا مِنْ لَدُنَّا) – (elə bir hörmətli yerdə məskun olublar ki,) **tərəfimizdən onlara ruzi olaraq hər cür meyvə cəm olub gəlir.** (وَلٰكِنَّ اَكْثَرَهُمْ لَا يَعْلَمُونَ) **- lakin onların çoxu** (cəhalətdə olduqlarından o ruzilərin bizim tərəfimizdən olduğunu) **bilməyib,** (başqa səbəblərə isnad edirlər. Bilsələrdi, anlayardılar ki, qorxu içində və ya əmin-amanlıqda olmaq Allah-Təaladandır. O vaxt Hz. Məhəmmədə iman gətirdikləri üçün müşriklərin onları Məkkədən qovmasından qorxmazdılar. Allah-Təala ona şərik qoşub bütpərəst olan müşrikləri öz evinin yanında xatircəm edib, hər cür

وَكَمْ اَهْلَكْنَا مِنْ قَرْيَةٍ بَطِرَتْ مَعِيشَتَهَاۚ فَتِلْكَ مَسَاكِنُهُمْ لَمْ تُسْكَنْ مِنْ بَعْدِهِمْ اِلَّا قَلِيلًاۜ وَكُنَّا نَحْنُ
الْوَارِثِينَ ﴿٥٨﴾ وَمَا كَانَ رَبُّكَ مُهْلِكَ الْقُرٰى حَتّٰى يَبْعَثَ فٖٓي اُمِّهَا رَسُولًا يَتْلُوا عَلَيْهِمْ اٰيَاتِنَاۚ وَمَا كُنَّا
مُهْلِكِي الْقُرٰٓى اِلَّا وَاَهْلُهَا ظَالِمُونَ ﴿٥٩﴾ وَمَٓا اُوتٖيتُمْ مِنْ شَيْءٍ فَمَتَاعُ الْحَيٰوةِ الدُّنْيَا وَزٖينَتُهَاۚ وَمَا
عِنْدَ اللّٰهِ خَيْرٌ وَاَبْقٰىۜ اَفَلَا تَعْقِلُونَ ﴿٦٠﴾

---

ruzi verirsə, necə ola bilər ki, Allah-Təalaya iman gətirib müvəhhid olanları zəlil edib müşriklərin əlində məğlub etsin? Xeyr, onlar islama girməmək üçün bəhanə gətirirlər)**.**

**58)** (وَكَمْ اَهْلَكْنَا مِنْ قَرْيَةٍ بَطِرَتْ مَعِيشَتَهَا) - (ey Məhəmməd)**, öz xoş güzəranı səbəbilə tüğyan edən neçə məmləkətin** (əhlini) **biz həlak etdik.** (فَتِلْكَ مَسَاكِنُهُمْ لَمْ تُسْكَنْ مِنْ بَعْدِهِمْ اِلَّا قَلِيلًا) - (siz müşriklər hər dəfə səfərə gedib gələndə onları görürsünüz)**, budur onların məskənləri** (boş qalıb)**, onlardan sonra az bir qismi** (yolçular və s.) **istisna olmaqla orda** (heç kim) **məskun olmayıbdır.** (İbrət almaları üçün boş və xaraba qalıbdır. Niyə ibrət almırsınız?) (وَكُنَّا نَحْنُ الْوَارِثِينَ) **-** (ey Məhəmməd, onları həlak edəndən sonra onların yurdlarına) **biz özümüz varis olduq.**

**59)** (وَمَا كَانَ رَبُّكَ مُهْلِكَ الْقُرٰى حَتّٰى يَبْعَثَ فٖٓي اُمِّهَا رَسُولًا) **-** (ey Məhəmməd)**, sənin rəbbin Allah-Təala onların ən böyük mərkəzinə** (anasına) **peyğəmbər göndərməmiş o məmləkətlərin** (əhlinə əzab göndərib) **həlak etmədi.** (يَتْلُوا عَلَيْهِمْ اٰيَاتِنَا) – (o peyğəmbər) **onlara ayələrimizi oxuyub** (hökmlərimizi çatdırar)**.** (وَمَا كُنَّا مُهْلِكِي الْقُرٰٓى اِلَّا وَاَهْلُهَا ظَالِمُونَ) **– biz yalnız əhalisi zalım olan məmləkətləri həlak etdik,** (sadəcə peyğəmbərə itaətsizlik edənləri deyil. Ancaq zülm etmələri onların məhvinə səbəb olur, adlarını müsəlman qoyduğu halda, zülmü özlərinə adət edənlər bu ayəyə baxıb utansınlar, Allah-Təala hətta zalım olmayan müşriklərə də əzab göndərmir. Buna görə, kimə əzab göndərilibsə, öz zülmü səbəbilədir. Bugünkü gündə yer kürəsinin əksər bölgələrindəki müsəlmanların əzab içində olmalarının səbəbi ancaq öz zülmləridir, islam ümməti bu mətləbə fikir verib diqqət etsinlər)**.**

**60)** (وَمَٓا اُوتٖيتُمْ مِنْ شَيْءٍ فَمَتَاعُ الْحَيٰوةِ الدُّنْيَا وَزٖينَتُهَا) **-** (Allah-Təala tərəfindən) **sizə nə bəxş edilibsə, onlar dünya həyatının malı və zinətidir,** (onlara aldanmayın, hamısı fani şeylərdir)**.** (وَمَا عِنْدَ اللّٰهِ خَيْرٌ وَاَبْقٰىۜ اَفَلَا تَعْقِلُونَ) **– Allah yanında olan** (axirət neməti) **isə daha yaxşı və əbədidir,** (fani olanı deyil, əbədi olanı istəyin)**, niyə düşünmürsünüz** (ki, dünya nemətlərini ancaq Allah-Təalanın əmr etdiyi yolda və ümmətin xeyir işlərində sərf etmək lazımdır, nəinki onu yığıb varislərdən ötrü anbarlarda saxlamaq, bu ağılsızların əməlidir)**.**

اَفَمَنْ وَعَدْنَاهُ وَعْدًا حَسَنًا فَهُوَ لَاقِيهِ كَمَنْ مَتَّعْنَاهُ مَتَاعَ الْحَيٰوةِ الدُّنْيَا ثُمَّ هُوَ يَوْمَ الْقِيٰمَةِ مِنَ الْمُحْضَرِينَ
﴿٦١﴾ وَيَوْمَ يُنَادِيهِمْ فَيَقُولُ اَيْنَ شُرَكَٓاءِيَ الَّذِينَ كُنْتُمْ تَزْعُمُونَ ﴿٦٢﴾ قَالَ الَّذِينَ حَقَّ عَلَيْهِمُ
الْقَوْلُ رَبَّنَا هٰٓؤُلَٓاءِ الَّذِينَ اَغْوَيْنَاۚ اَغْوَيْنَاهُمْ كَمَا غَوَيْنَاۚ تَبَرَّأْنَٓا اِلَيْكَ مَا كَانُوٓا اِيَّانَا يَعْبُدُونَ ﴿٦٣﴾ وَقِيلَ
ادْعُوا شُرَكَٓاءَكُمْ فَدَعَوْهُمْ فَلَمْ يَسْتَجِيبُوا لَهُمْ وَرَاَوُا الْعَذَابَۚ لَوْ اَنَّهُمْ كَانُوا يَهْتَدُونَ ﴿٦٤﴾ وَيَوْمَ
يُنَادِيهِمْ فَيَقُولُ مَاذَٓا اَجَبْتُمُ الْمُرْسَلِينَ ﴿٦٥﴾ فَعَمِيَتْ عَلَيْهِمُ الْاَنْبَٓاءُ يَوْمَئِذٍ فَهُمْ لَا يَتَسَٓاءَلُونَ ﴿٦٦﴾

---

**61)** (اَفَمَنْ وَعَدْنَاهُ وَعْدًا حَسَنًا فَهُوَ لَاقِيهِ) – (dünyada xeyir əməli səbəbilə axirətdə) **gözəl** (savab) **vəd etdiyimiz və ona qovuşacağını** (bilən) **şəxs,** (كَمَنْ مَتَّعْنَاهُ مَتَاعَ الْحَيٰوةِ الدُّنْيَا ثُمَّ هُوَ يَوْمَ الْقِيٰمَةِ مِنَ الْمُحْضَرِينَ) **- dünya həyatında ona** (ləziz) **nemət verib,** (bununla da aldanıb asi olan, öləndən) **sonra da qiyamət günündə** (cəhənnəm oduna) **gətirilən şəxs ilə eyni ola bilərmi?** (Əlbəttə, bu iki şəxs bərabər olmaz)**.**

**62)** (وَيَوْمَ يُنَادِيهِمْ فَيَقُولُ اَيْنَ شُرَكَٓاءِيَ الَّذِينَ كُنْتُمْ تَزْعُمُونَ) **- o gün** (qiyamət günü) **Allah-Təala** (müşrikləri) **çağırıb onlara deyər:** (ey müşriklər, etiqad və) **iddia etdiyiniz şəriklərim hanı?** (Bugünkü gündə onları gətirin)**.**

**63)** (قَالَ الَّذِينَ حَقَّ عَلَيْهِمُ الْقَوْلُ) – (Allah-Təalanın) **haqlarında** (əzab) **sözü vacib olanlar,** (yəni müşriklərin rəisləri) **deyərlər:** (رَبَّنَا هٰٓؤُلَٓاءِ الَّذِينَ اَغْوَيْنَا) **- ey bizim rəbbimiz, bunlar bizim azdırıb** (zəlalətə saldığımız) **şəxslərdir.** (اَغْوَيْنَاهُمْ كَمَا غَوَيْنَا) **– özümüz necə azıb** (zəlalətə düşmüşüksə)**, onları da** (dəvət edib öz ixtiyarları ilə) **elə azdırıb** (zəlalətə düçar etdik)**.** (تَبَرَّأْنَٓا اِلَيْكَ) – (ey bizim rəbbimiz)**, biz onlardan uzaqlaşıb sənə gəldik,** (onları zorla haqdan uzaqlaşdırıb, şirkə vadar etmədik. Özləri küfr və şirki seçib zəlalətdə qaldılar). (مَا كَانُوٓا اِيَّانَا يَعْبُدُونَ) **- əslində, onlar bizə ibadət etmirdilər,** (öz nəfslərinə ibadət edirdilər)**.**

**64)** (وَقِيلَ ادْعُوا شُرَكَٓاءَكُمْ) – (qiyamət günündə müşriklərə deyilər: "Allah-Təalaya ortaq qoşduğunuz) **şəriklərinizi çağırın,** (qoy bugünkü gündə gəlib sizi əzabdan xilas etsinlər). (فَدَعَوْهُمْ فَلَمْ يَسْتَجِيبُوا لَهُمْ) **- onlar da** (şərikləri) **çağırarlar, lakin** (şəriklər) **onlara cavab verməzlər.** (وَرَاَوُا الْعَذَابَ لَوْ اَنَّهُمْ كَانُوا يَهْتَدُونَ) **- əzabı görüb (bəlaya düçar olacaqlarını anlarlar. O vaxt da arzu edərlər ki, kaş** (bir çarə ilə) **hidayət tapıb,** (əzabı özlərindən dəf edəydilər)**.**

**65)** (وَيَوْمَ يُنَادِيهِمْ فَيَقُولُ مَاذَٓا اَجَبْتُمُ الْمُرْسَلِينَ) **– o gün** (qiyamət günü Allah-Təala kafir və müşrikləri) **çağırıb onlara deyər:** (bizim tərəfimizdən gəlib sizi dəvət edən) **peyğəmbərlərə nə cavab verdiniz?**

**66)** (فَعَمِيَتْ عَلَيْهِمُ الْاَنْبَٓاءُ يَوْمَئِذٍ) **-** (kor şəxsə görünən şeylər məxfi qalan kimi) **onlara da hər bir** (üzr, bəhanə və dəlil kimi) **xəbərlər** (qiyamət) **günü məxfi qalıb** (heç bir cavab verə bilməzlər). (فَهُمْ لَا يَتَسَٓاءَلُونَ) **- öz aralarında da bir-**

فَاَمَّا مَنْ تَابَ وَاٰمَنَ وَعَمِلَ صَالِحًا فَعَسٰٓى اَنْ يَكُونَ مِنَ الْمُفْلِحِينَ ﴿٦٧﴾ وَرَبُّكَ يَخْلُقُ مَا
يَشَآءُ وَيَخْتَارُ مَا كَانَ لَهُمُ الْخِيَرَةُ سُبْحَانَ اللّٰهِ وَتَعَالٰى عَمَّا يُشْرِكُونَ ﴿٦٨﴾ وَرَبُّكَ يَعْلَمُ مَا تُكِنُّ
صُدُورُهُمْ وَمَا يُعْلِنُونَ ﴿٦٩﴾ وَهُوَ اللّٰهُ لَٓا اِلٰهَ اِلَّا هُوَ لَهُ الْحَمْدُ فِي الْاُولٰى وَالْاٰخِرَةِ وَلَهُ الْحُكْمُ
وَاِلَيْهِ تُرْجَعُونَ ﴿٧٠﴾ قُلْ اَرَاَيْتُمْ اِنْ جَعَلَ اللّٰهُ عَلَيْكُمُ الَّيْلَ سَرْمَدًا اِلٰى يَوْمِ الْقِيٰمَةِ مَنْ اِلٰهٌ غَيْرُ
اللّٰهِ يَأْتِيكُمْ بِضِيَآءٍ

---

**birilərindən soruşa da bilməzlər.** (Necə ki müşkül məsələlərdə camaat bir-biriylə məşvərət edib sual-cavab edirlər, axirətdə müşriklərdən ötrü bu da mümkün olmaz)**.**

**67)** (فَاَمَّا مَنْ تَابَ وَاٰمَنَ وَعَمِلَ صَالِحًا) **- amma** (müşriklərdən) **kim tövbə edib** (şirkdən dönüb)**, iman gətirib yaxşı əməl etsə,** (فَعَسٰى اَنْ يَكُونَ مِنَ الْمُفْلِحِينَ) **– o, ümidvar olsun ki,** (axirət günündə əzabdan) **nicat tapanlardan olacaqdır.**

**68)** (وَرَبُّكَ يَخْلُقُ مَا يَشَآءُ وَيَخْتَارُ) **-** (ey Məhəmməd)**, sənin rəbbin istədiyini yaradar və seçər.** (مَا كَانَ لَهُمُ الْخِيَرَةُ) – (insanların Allah-Təaladan ötrü bir şey seçməyə) **ixtiyarları yoxdur.** (Məsələn, desinlər ki, Allah-Təala filan şeyi filan cür etsəydi, yaxşı olardı, necə ki Məkkə əhli belə deyirdilər: "Bir halda ki, Allah-Təala peyğəmbər göndərir, niyə Əbu Talibin yetimini göndərir? Gərək, Məkkədən Vəlid ibn Müğirəni, ya da Taifdən Urvə ibn Məsudu peyğəmbər göndərəydi." Allah-Təala müşriklərin cavabında bu ayəni buyurdu:) (سُبْحَانَ اللّٰهِ وَتَعَالٰى عَمَّا يُشْرِكُونَ) **- Allah-Təala hər bir eyib və nöqsandan pak və müqəddəsdir, ona şərik qoşulanlardan ucadır.**

**69)** (وَرَبُّكَ يَعْلَمُ مَا تُكِنُّ صُدُورُهُمْ وَمَا يُعْلِنُونَ) – (Allah-Təala müşriklərin Hz. Peyğəmbərə ədavətdən ötrü) **sinələrində gizlətdiklərinə və aşkar edib** (o peyğəmbər olmağa layiq deyil, gərək, filan və filankəs olaydı - dediklərinə də) **agahdır,** (Allah-Təala onların açıq və ya gizlin dediklərinin cəzasını özlərinə verəcəkdir)**.**

**70)** (وَهُوَ اللّٰهُ لَٓا اِلٰهَ اِلَّا هُوَ) **– O,** (yeganə) **Allah-Təaladır, Ondan başqa heç bir** (haqq) **məbud** (və ilahiliyə layiq olan yoxdur)**,** (لَهُ الْحَمْدُ فِي الْاُولٰى وَالْاٰخِرَةِ) **- həm dünyada, həm də axirətdə həmd-səna Ona məxsusdur.** (وَلَهُ الْحُكْمُ) – (bəndələrinin arasında) **hökm edib** (hər kəsə öz cəzasını vermək də) **Ona məxsusdur.** (Bu işlərdə heç bir şəriki yoxdur)**.** (وَاِلَيْهِ تُرْجَعُونَ) – (siz insanlar) **hamınız öləndən sonra** (dirilib, haqq-hesabdan ötrü Allah-Təalanın) **tərəfinə qayıdacaqsınız.**

**71)** (قُلْ اَرَاَيْتُمْ اِنْ جَعَلَ اللّٰهُ عَلَيْكُمُ الَّيْلَ سَرْمَدًا اِلٰى يَوْمِ الْقِيٰمَةِ) - (ey Məhəmməd, müşriklərə) **de ki, əgər Allah-Təala gecəni qiyamətə kimi sizə davamlı edib,** (heç gündüz olmasaydı)**,** (مَنْ اِلٰهٌ غَيْرُ اللّٰهِ يَأْتِيكُمْ بِضِيَآءٍ) **- Allah-Təaladan baş-**

اَفَلَا تَسْمَعُونَ ﴿٧١﴾ قُلْ اَرَاَيْتُمْ اِنْ جَعَلَ اللّٰهُ عَلَيْكُمُ النَّهَارَ سَرْمَدًا اِلٰى يَوْمِ الْقِيٰمَةِ مَنْ اِلٰهٌ غَيْرُ
اللّٰهِ يَأْتِيكُمْ بِلَيْلٍ تَسْكُنُونَ فِيهِۜ اَفَلَا تُبْصِرُونَ ﴿٧٢﴾ وَمِنْ رَحْمَتِهٖ جَعَلَ لَكُمُ الَّيْلَ وَالنَّهَارَ لِتَسْكُنُوا
فِيهِ وَلِتَبْتَغُوا مِنْ فَضْلِهٖ وَلَعَلَّكُمْ تَشْكُرُونَ ﴿٧٣﴾ وَيَوْمَ يُنَادِيهِمْ فَيَقُولُ اَيْنَ شُرَكَٓاءِيَ الَّذِينَ كُنْتُمْ
تَزْعُمُونَ ﴿٧٤﴾ وَنَزَعْنَا مِنْ كُلِّ اُمَّةٍ شَهِيدًا فَقُلْنَا هَاتُوا بُرْهَانَكُمْ فَعَلِمُوٓا اَنَّ الْحَقَّ لِلّٰهِ وَضَلَّ عَنْهُمْ
مَا كَانُوا يَفْتَرُونَ۟ ﴿٧٥﴾

---

**qa hansı tanrı sizdən ötrü işıq gətirib** (gündüzü yarada bilərdi ki, işinizlə məşğul olasınız? Allah-Təaladan başqa heç kim buna qadir deyil, gecəni və gündüzü yaradan Allah-Təaladır)**.** (اَفَلَا تَسْمَعُونَ) **– bəs** (Allah-Təalanın sözlərini) **eşidib** (dərk edib qəbul etməzsiniz?)

**72)** (قُلْ اَرَاَيْتُمْ اِنْ جَعَلَ اللّٰهُ عَلَيْكُمُ النَّهَارَ سَرْمَدًا اِلٰى يَوْمِ الْقِيٰمَةِ) **-** (ey Məhəmməd, müşriklərə) **de ki, əgər Allah-Təala gündüzü sizə daimi edib, qiyamətə kimi** (heç gecə olmasaydı ki, istirahətlə məşğul olasınız)**,** (مَنْ اِلٰهٌ غَيْرُ اللّٰهِ يَأْتِيكُمْ بِلَيْلٍ تَسْكُنُونَ فِيهِ) **- Allah-Təaladan başqa hansı tanrı gecəni sizə gətirərdi ki, istirahət edəsiniz?** (Allah-Təaladan başqa gecə və gündüzü gətirməyə heç kim qadir deyil)**.** (اَفَلَا تُبْصِرُونَ) **– bəs baxıb görmürsünüz** (ki, gecədə rahatlıq və mənfəət var? Allah-Təala gecəni də, gündüzü də öz lütf və rəhmətilə sizdən ötrü yaradıb, bəxş edibdir, gərək, Allah-Təalanın bu nemətinə şükür edəsiniz. Nəinki kafir olub inkar edəsiniz)**.**

**73)** (وَمِنْ رَحْمَتِهٖ جَعَلَ لَكُمُ الَّيْلَ وَالنَّهَارَ) – (Allah-Təala) **öz lütf və rəhmətindən sizin üçün gecəni və gündüzü yaratdı.** (لِتَسْكُنُوا فِيهِ وَلِتَبْتَغُوا مِنْ فَضْلِهٖ) **– belə ki,** (gecə) **dincəlib, gündüz də** (Allah-Təalanın) **lütf və rəhmətindən** (ruzi) **istəyəsiniz.** (وَلَعَلَّكُمْ تَشْكُرُونَ) **- və** (Allah-Təala istəyir ki, öz ixtiyarınızla onun verdiyi gecə və gündüz nemətlərinə) **şükür edəsiniz.**

**74)** (وَيَوْمَ يُنَادِيهِمْ فَيَقُولُ اَيْنَ شُرَكَٓاءِيَ الَّذِينَ كُنْتُمْ تَزْعُمُونَ) – (qiyamət) **günü** (Allah-Təala müşrikləri çağırıb) **deyər: "İddia** (və etiqad) **etdiyiniz şəriklərim hanı?"**

**75)** (وَنَزَعْنَا مِنْ كُلِّ اُمَّةٍ شَهِيدًا) – (qiyamət günü) **hər ümmətin özündən** (onların öz əməllərinə öz peyğəmbərlərini) **şahid** (göstərib) **çıxararıq.** (فَقُلْنَا هَاتُوا بُرْهَانَكُمْ) – (ondan sonra o peyğəmbərin ümmətinə) **deyərik:** (peyğəmbərə müxalif olub Allah-Təalaya şərik qoşmaq haqqındakı) **dəlil və sübutlarınızı gətirin.** (O vaxt da dəlil gətirməkdən aciz qalıb, peyğəmbərlər də onların müşrik olduğuna şəhadət edərlər)**.** (فَعَلِمُوا اَنَّ الْحَقَّ لِلّٰهِ) **- o vaxt da** (müşriklər) **bilərlər ki, haqq ancaq Allah-Təalaya məxsusdur,** (nəinki onların şeytanlarına)**.** (وَضَلَّ عَنْهُمْ مَا كَانُوا يَفْتَرُونَ) **- və** (müşriklərin Allah-Təalaya yalandan isnad edib) **uydurduqları** (sözlər qiyamət günü) **itib qeyb olar.**

اِنَّ قَارُونَ كَانَ مِنْ قَوْمِ مُوسٰى فَبَغٰى عَلَيْهِمْۖ وَاٰتَيْنَاهُ مِنَ الْكُنُوزِ مَٓا اِنَّ مَفَاتِحَهُ لَتَنُٓوأُ بِالْعُصْبَةِ اُو۬لِي
الْقُوَّةِۗ اِذْ قَالَ لَهُ قَوْمُهُ لَا تَفْرَحْ اِنَّ اللّٰهَ لَا يُحِبُّ الْفَرِحِينَ ﴿٧٦﴾ وَابْتَغِ فِيمَٓا اٰتٰيكَ اللّٰهُ الدَّارَ الْاٰخِرَةَ
وَلَا تَنْسَ نَص۪يبَكَ مِنَ الدُّنْيَا وَاَحْسِنْ كَمَٓا اَحْسَنَ اللّٰهُ اِلَيْكَ وَلَا تَبْغِ الْفَسَادَ فِي الْاَرْضِۜ اِنَّ اللّٰهَ لَا
يُحِبُّ الْمُفْسِد۪ينَ ﴿٧٧﴾ قَالَ اِنَّمَٓا اُو۫ت۪يتُهُ عَلٰى عِلْمٍ عِنْد۪يۜ اَوَلَمْ يَعْلَمْ اَنَّ اللّٰهَ قَدْ اَهْلَكَ مِنْ قَبْلِه۪ مِنَ
الْقُرُونِ مَنْ هُوَ اَشَدُّ مِنْهُ قُوَّةً وَاَكْثَرُ جَمْعاًۜ

---

**76)** (اِنَّ قَارُونَ كَانَ مِنْ قَوْمِ مُوسٰى) **- həqiqətən,** (fironun xidmətçilərindən olan)* **Qarun** (Musanın) **qövmündən** (bəni-İsraildən) **idi.** (فَبَغٰى عَلَيْهِمْ) – (firon onu bəni-İsrailə əmir təyin edib)**, o da** (bəni-İsrailə) **həddsiz zülm etmişdi.** (وَاٰتَيْنَاهُ مِنَ الْكُنُوزِ مَٓا اِنَّ مَفَاتِحَهُ لَتَنُٓوأُ بِالْعُصْبَةِ اُو۬لِي الْقُوَّةِ) – (Qaruna) **elə xəzinələr verdik ki, onun açarlarını** (içindəki qızıl və gümüşü) **bir dəstə** (10-15) **güclü adam zorla daşıyardı.** (اِذْ قَالَ لَهُ قَوْمُهُ لَا تَفْرَحْ اِنَّ اللّٰهَ لَا يُحِبُّ الْفَرِحِينَ) **- öz qövmü** (bəni-İsrail Qaruna) **dedi:** (dünya malına və vəzifənə sevinmə)**, həqiqətən, Allah-Təala belələrini sevməz.**

*(*Qeyd: Qarunun xəzinəsi barəsində həddən artıq mənasız sözlər yazıblar. Təfsirçilərin sözünə baxsaq, guya bütün dünya hökmdarlarının xəzinələri bir yerə toplansa, yenə Qarunun var-dövlətinə çatmaz. Mən həqir belə mənasız şeyləri yazmaqdan vaz keçdim. Belə məlum olur ki, keçmiş üləmalar qızıl, gümüşün və ləl-cavahiratın nə olduğuna agah olmayıblar. Guya, onların nəzərində torpaq kimi bir şey olub, götürüb anbara doldurursan. Əgər belə olsaydı, bu mətləb Qaruna məxsus olmayıb, hər bir yazıçı da özündən ötrü belə var-dövlət cəm edə bilərdi. Nə isə Qarun öz zamanında varlı bir şəxs imiş, bir tərəfdən zənginliyi ilə, digər tərəfdən fironun əmiri kimi özü ilə fəxr edib bəni-İsrailə əziyyət edirdi).*

**77)** (وَابْتَغِ فِيمَٓا اٰتٰيكَ اللّٰهُ الدَّارَ الْاٰخِرَةَ) - (ey Qarun)**, Allah-Təalanın sənə bəxş etdiyi** (var-dövlətlə xeyir iş görüb) **axirət yurdunu istə,** (bu var-dövlətin hamısı fani olacaqdır)**.** (وَلَا تَنْسَ نَص۪يبَكَ مِنَ الدُّنْيَا) **- dünyadan da nəsibini unutma.** (Zəruri miqdarda dünya malı, yemək, paltar və s. sənə, ailənə də lazımdır. Artığı lazım deyil, gərək Allah-Təala yolunda sərf edəsən)**.** (وَاَحْسِنْ كَمَٓا اَحْسَنَ اللّٰهُ اِلَيْكَ) **- Allah-Təala sənə ehsan etdiyi kimi, sən də** (Allah-Təalanın bəndələrinə) **ehsan et.** (وَلَا تَبْغِ الْفَسَادَ فِي الْاَرْضِ) **- yer üzündə fəsad törədib** (camaata zülm etmə)**.** (اِنَّ اللّٰهَ لَا يُحِبُّ الْمُفْسِد۪ينَ) **- həqiqətən, Allah-Təala fəsadçıları sevməz.**

**78)** (قَالَ اِنَّمَٓا اُو۫ت۪يتُهُ عَلٰى عِلْمٍ عِنْد۪ي) – (Qarun) **dedi: “**(zənnimcə) **bu var-dövlət mənə yalnız məndə olan** (məharət və ticarət) **elmi sayəsində verilmişdir.”** (اَوَلَمْ يَعْلَمْ اَنَّ اللّٰهَ قَدْ اَهْلَكَ مِنْ قَبْلِه۪ مِنَ الْقُرُونِ مَنْ هُوَ اَشَدُّ مِنْهُ قُوَّةً وَاَكْثَرُ جَمْعاً) - (Allah-Təala Qarunun cavabında belə deyir: “Qarun iddia edirdi ki, öz elminə görə bu var-dövləti əldə edib)**, bəs bilmir ki, Allah-Təala özündən əvvəlki nəsillərdən ondan daha güclü və daha zəngin şəxsləri həlak edibdir.** (Bunu bildiyi hal-

وَلَا يُسْئَلُ عَنْ ذُنُوبِهِمُ الْمُجْرِمُونَ ﴿٧٨﴾ فَخَرَجَ عَلٰى قَوْمِهِ فِي زِينَتِهِۜ قَالَ الَّذِينَ يُرِيدُونَ الْحَيٰوةَ
الدُّنْيَا يَا لَيْتَ لَنَا مِثْلَ مَآ اُوتِيَ قَارُونُۙ اِنَّهُ لَذُو حَظٍّ عَظِيمٍ ﴿٧٩﴾ وَقَالَ الَّذِينَ اُوتُوا الْعِلْمَ وَيْلَكُمْ
ثَوَابُ اللّٰهِ خَيْرٌ لِمَنْ اٰمَنَ وَعَمِلَ صَالِحًاۚ وَلَا يُلَقّٰيهَآ اِلَّا الصَّابِرُونَ ﴿٨٠﴾ فَخَسَفْنَا بِهِ وَبِدَارِهِ
الْاَرْضَ فَمَا كَانَ لَهُ مِنْ فِئَةٍ يَنْصُرُونَهُ مِنْ دُونِ اللّٰهِۗ وَمَا كَانَ مِنَ الْمُنْتَصِرِينَ ﴿٨١﴾ وَاَصْبَحَ الَّذِينَ
تَمَنَّوْا مَكَانَهُ بِالْاَمْسِ يَقُولُونَ وَيْكَاَنَّ اللّٰهَ يَبْسُطُ الرِّزْقَ لِمَنْ يَشَٓاءُ مِنْ عِبَادِهِ وَيَقْدِرُۚ

---

da, var-dövlətə aldanıb, camaata zülm edib kafir olmaq əvəzinə, gərək, Allah-Təalaya şükür edəydi). (وَلَا يُسْئَلُ عَنْ ذُنُوبِهِمُ الْمُجْرِمُونَ) – **günahkarların sorğu-sual edilmələrinə ehtiyac yoxdur,** (Allah-Təala Qarun kimilərin günahına agahdır və əzab etməyə də qadirdir)**.**

**79)** (فَخَرَجَ عَلٰى قَوْمِهِ فِي زِينَتِهِ) – (Qarun) **öz zinəti içində** (qızıl və ləl-cavahiratla bəzəndiyi halda) **qövmünün** (bəni-İsrailin) **qarşısına çıxdı,** (bəni-İsrail onu o halətdə gördükdə, hamısı çaşqın qaldı)**.** (قَالَ الَّذِينَ يُرِيدُونَ الْحَيٰوةَ الدُّنْيَا) – (bəni-İsrail camaatından) **dünya həyatını istəyən şəxslər dedilər:** (يَا لَيْتَ لَنَا مِثْلَ مَٓا اُوتِيَ قَارُونُ) **- "Kaş bizdən ötrü də Qaruna verilənin bənzəri olaydı,** (اِنَّهُ لَذُو حَظٍّ عَظِيمٍ) **- həqiqətən,** (Qarun) **dünyada böyük qismət** (və var-dövlət) **sahibidir."**

**80)** (وَقَالَ الَّذِينَ اُوتُوا الْعِلْمَ) – (Allah-Təalanın tövhidi haqqında özlərinə) **elm verilmiş şəxslər isə** (onların cavabında) **dedilər:** (وَيْلَكُمْ ثَوَابُ اللّٰهِ خَيْرٌ لِمَنْ اٰمَنَ وَعَمِلَ صَالِحًا) **- "Vvay halınıza,** (belə sözlərdən uzaq olun. Qarunun var-dövləti sizi aldatmasın)**. Allah-Təalanın** (axirətdə verəcəyi) **savab** (Allah-Təalaya) **iman gətirib** (müvəhhid olub) **saleh əməl edən şəxslərdən ötrü** (Qarunun var-dövlətindən) **daha yaxşıdır.** (وَلَا يُلَقّٰيهَآ اِلَّا الصَّابِرُونَ) - (Allah-Təalanın ibadətinə davam edib, günahları tərk etmədə) **səbir edən şəxslərdən başqası** (saleh əməllərin savabına) **qovuşmaz."**

**81)** (فَخَسَفْنَا بِهِ وَبِدَارِهِ الْاَرْضَ) – (Qarunun zülmü həddini aşandan sonra) **onun özünü** (və xəzinəsini)**, sarayını yerə batırdıq.** (Heç bir izi qalmadı. Necə ki şiddətli zəlzələdən yer yarılıb kəndlər və şəhərlər batır, Qarunun da sonu elə oldu)**.** (فَمَا كَانَ لَهُ مِنْ فِئَةٍ يَنْصُرُونَهُ مِنْ دُونِ اللّٰهِ) **- Allah-Təaladan başqa, ona kömək edib** (əzabdan qurtarıb nicat verəcək) **tərəfdarı da olmadı.** (وَمَا كَانَ مِنَ الْمُنْتَصِرِينَ) **- özü də** (qüvvət və qüdrət sahibi olub əzabdan) **özünü xilas edənlərdən deyildi.**

**82)** (وَاَصْبَحَ الَّذِينَ تَمَنَّوْا مَكَانَهُ بِالْاَمْسِ يَقُولُونَ) **- dünən** (Qarunun) **məqamında olmağı arzu edənlər** (o həlak olandan sonra) **ertəsi səhər belə dedilər.** (وَيْكَاَنَّ اللّٰهَ يَبْسُطُ الرِّزْقَ لِمَنْ يَشَٓاءُ مِنْ عِبَادِهِ وَيَقْدِرُ) – **vay halımıza,** (biz bilməmişik)**, demək Allah-Təala bəndələrindən istədiyinin ruzisini artırar, istədiyini azal-**

لَوْلَٓا اَنْ مَنَّ اللّٰهُ عَلَيْنَا لَخَسَفَ بِنَاۜ وَيْكَاَنَّهُ لَا يُفْلِحُ الْكَافِرُونَ ﴿٨٢﴾ تِلْكَ الدَّارُ الْاٰخِرَةُ نَجْعَلُهَا
لِلَّذِينَ لَا يُرِيدُونَ عُلُوًّا فِي الْاَرْضِ وَلَا فَسَادًاۜ وَالْعَاقِبَةُ لِلْمُتَّقِينَ ﴿٨٣﴾ مَنْ جَٓاءَ بِالْحَسَنَةِ فَلَهُ
خَيْرٌ مِنْهَاۚ وَمَنْ جَٓاءَ بِالسَّيِّئَةِ فَلَا يُجْزَى الَّذِينَ عَمِلُوا السَّيِّئَاتِ اِلَّا مَا كَانُوا يَعْمَلُونَ ﴿٨٤﴾
اِنَّ الَّذِي فَرَضَ عَلَيْكَ الْقُرْاٰنَ لَرَٓادُّكَ اِلٰى مَعَادٍۜ قُلْ رَبّ۪ٓي اَعْلَمُ مَنْ جَٓاءَ بِالْهُدٰى وَمَنْ هُوَ ف۪ي
ضَلَالٍ مُب۪ينٍ ﴿٨٥﴾

---

**dar.** (لَوْلَٓا اَنْ مَنَّ اللّٰهُ عَلَيْنَا لَخَسَفَ بِنَا) **- əgər Allah-Təala bizə rəhm edib** (nemət verməsəydi)**, bizi də** (Qarun kimi) **yerə batırardı.** (Bu ayə işarə edir ki, Qarun özü və imarəti zəlzələ nəticəsində yerə qərq olub digər bəni-İsrail camaatı nicat tapdılar). (وَيْكَاَنَّهُ لَا يُفْلِحُ الْكَافِرُونَ) **– vay halımıza,** (biz bilməmişik)**, demək, kafirlər** (əzabdan) **nicat tapmayacaqlar.**

**83)** (تِلْكَ الدَّارُ الْاٰخِرَةُ نَجْعَلُهَا لِلَّذِينَ لَا يُرِيدُونَ عُلُوًّا فِي الْاَرْضِ وَلَا فَسَادًا) - (bu ayə - "kafirlər nicat tapmayacaqlar", ayəsini təsdiq edir:) **biz bu axirət evini** (yəni cənnəti) **yer üzündə fitnə-fəsad törətməyənlərdən ötrü hazır edərik.** (وَالْعَاقِبَةُ لِلْمُتَّقِينَ) – (qiyamət günündə gözəl) **aqibət müttəqilərdən ötrüdür.** (Hz. Əli (ə.s), buyurubdur: "Kim öz nəleyninin bağının yoldaşının nəleyninin bağından yaxşı olmasını istəsə, bu ayənin ehtivasına daxildir", (yəni o şəxs təkəbbürlü və fitnə-fəsadçılardan olub cənnətə girməyə layiq deyil. İmamın bu kəlamına diqqət etmək lazımdır)**.**

**84)** (مَنْ جَٓاءَ بِالْحَسَنَةِ) **- kim** (qiyamət günündə Allahın hüzuruna) **xeyir** (əməllə) **gəlsə,** (فَلَهُ خَيْرٌ مِنْهَا) **- o şəxsdən ötrü** (Allah-Təala yanında öz əməlindən də) **yaxşı əcr və savab vardır.** (وَمَنْ جَٓاءَ بِالسَّيِّئَةِ) **- və kim** (qiyamət günü Allahın hüzuruna) **şər** (bir əməllə) **gəlsə,** (فَلَا يُجْزَى الَّذِينَ عَمِلُوا السَّيِّئَاتِ اِلَّا مَا كَانُوا يَعْمَلُونَ) **- şər** (və günah edənə) **etdiyindən artıq cəza verilməz.** (Allah-Təalanın lütf və kəramətindəndir ki, günah əmələ onun misli qədər cəza verir, amma savab əmələ 700 misli qədər mükafat verir)**.**

**85)** (اِنَّ الَّذِي فَرَضَ عَلَيْكَ الْقُرْاٰنَ لَرَٓادُّكَ اِلٰى مَعَادٍ) - (ey Məhəmməd)**, həqiqətən, Quranı** (oxuyub əməl etməyi və xalqa təbliğ etməyi) **vacib edən** (Allah-Təala Qüreyş səni bu Məkkədən qovandan sonra) **qayıdacağın yerə** (Məkkəyə) **qaytaracaqdır.** (Bu, Allah-Təalanın peyğəmbərinə verdiyi vəddir, yəni Məkkə əhli sənə qalib olub səni Məkkədən çıxarandan sonra o Allah-Təala səni yenidən Məkkəyə qaytaracaqdır. Allah-Təalanın vədi doğru olub hicri 8-ci ildə Hz. Peyğəmbər gedib Məkkəni fəth edib öz vətəninə daxil oldu. Hz. Peyğəmbərin haqq və doğru olduğuna bu bir dəlildir). (قُلْ رَبّ۪ٓي اَعْلَمُ مَنْ جَٓاءَ بِالْهُدٰى) - (ey Məhəmməd, müşriklərə) **de ki, mənim rəbbim Allah-Təala kimin hidayətlə gəldiyini bilir,** (وَمَنْ هُوَ ف۪ي ضَلَالٍ مُب۪ينٍ) **- və kimin də açıq-aşkar zəlalətdə** (küfr və şirkdə) **qaldığını,** (yəni siz müşrikləri bilir)**.**

وَمَا كُنْتَ تَرْجُوٓا اَنْ يُلْقٰىٓ اِلَيْكَ الْكِتَابُ اِلَّا رَحْمَةً مِنْ رَبِّكَ فَلَا تَكُونَنَّ ظَهِيرًا لِلْكَافِرِينَ ﴿٨٦﴾ وَلَا يَصُدُّنَّكَ عَنْ اٰيَاتِ اللّٰهِ بَعْدَ اِذْ اُنْزِلَتْ اِلَيْكَ وَادْعُ اِلٰى رَبِّكَ وَلَا تَكُونَنَّ مِنَ الْمُشْرِكِينَ ﴿٨٧﴾ وَلَا تَدْعُ مَعَ اللّٰهِ اِلٰهًا اٰخَرَ لَآ اِلٰهَ اِلَّا هُوَ كُلُّ شَيْءٍ هَالِكٌ اِلَّا وَجْهَهُ لَهُ الْحُكْمُ وَاِلَيْهِ تُرْجَعُونَ ﴿٨٨﴾

---

**86)** (وَمَا كُنْتَ تَرْجُوا اَنْ يُلْقٰى اِلَيْكَ الْكِتَابُ اِلَّا رَحْمَةً مِنْ رَبِّكَ) - (ey Məhəmməd)**, sən** (Allah-Təala tərəfindən olan) **kitabın** (Quranın) **sənə nazil olacağına ümid etmirdin, lakin Allah-Təala öz lütf və rəhmətindən** (bu Quranı sənə nazil etdi)**.** (فَلَا تَكُونَنَّ ظَهِيرًا لِلْكَافِرِينَ) **- əlbəttə sən kafir** (və müşriklərə) **arxa olma.**

**87)** (وَلَا يَصُدُّنَّكَ عَنْ اٰيَاتِ اللّٰهِ بَعْدَ اِذْ اُنْزِلَتْ اِلَيْكَ) **-** (Qurani-Şərif) **sənə nazil olandan sonra** (bu müşriklər) **səni Allah-Təalanın ayələrinə** (Quranın ehkamına əməl etməkdən) **çəkindirməsinlər.** (وَادْعُ اِلٰى رَبِّكَ وَلَا تَكُونَنَّ مِنَ الْمُشْرِكِينَ) **-** (ey Məhəmməd, müşrikləri) **öz rəbbin Allah-Təala tərəfinə dəvət et. Sən özün də müşriklərdən olma.**

**88)** (وَلَا تَدْعُ مَعَ اللّٰهِ اِلٰهًا اٰخَرَ) **- Allah-Təala ilə yanaşı başqa bir məbuda ibadət edib** (Ona şərik qoşma)**.** (لَآ اِلٰهَ اِلَّا هُوَ) **–** (yeganə olan Allah-Təaladan) **başqa, heç bir** (haqq) **məbud yoxdur,** (كُلُّ شَيْءٍ هَالِكٌ اِلَّا وَجْهَهُ) **– Onun** (pak, müqəddəs) **Zatından başqa, hər şey həlak olub** (fani olacaq, ancaq bütün aləmlərin xaliqi olan o müqəddəs, pak Zat fani olmayıb, əzəli və əbədidir)**.** (لَهُ الْحُكْمُ) **–** (qiyamət günü məxluqatın arasında haqq və ədalət üzrə) **hökm etmək Ona məxsusdur.** (وَاِلَيْهِ تُرْجَعُونَ) **- hamınız qiyamət günündə Onun tərəfinə qayıdacaqsınız** (və əməllərinizin qarşılığını alacaqsınız. Bu ayələr hərçənd Hz. Peyğəmbərə xitabdır, amma məqsəd möminləri imanlarında möhkəm etməkdir, yoxsa xalqı şirk, zəlalətdən tövhid və hidayət tərəfinə dəvət edən şəxsin kafirlərə kömək etməsi və ya şirkə meyil etməsi təsəvvür edilə bilməz)**.**

Allaha həmd olsun, Qəsəs surəsinin təfsiri bitdi, Hz. Peyğəmbər buyurubdur: "Qəsəs surəsini kim oxusa, qiyamət günündə ondan ötrü şəhadət edilər ki, bu şəxs bu surənin axırında vaqe olan ayəni təsdiq etməkdə sadiqdir." (Nə gözəl və uca məzmunlara, hikmətamiz kəlamlara şamil olan surədir, nə xoşdur o zəki şəxslər ki, bu mübarək surənin açıq-aydın ayələrini təfəkkür edib onun hikmət və moizələrindən faydalanırlar. Vay o şəxslərin halına ki, bu mübarək surənin, bəlkə, bütün Quranın ayələrini yemək yeyirmiş kimi iki çənəsinin arasına salıb kəlmə və hərflərini çeynəyir, amma onların ehtiva etdiyi dünya və axirət qanunlarının mənfəətlərindən agah olmayıb özlərini "kitab daşıyan eşşək" ayəsinin məzmununa daxil edirlər. Qurani-Şərifin eh-

kam və nəsihətlərinin müsəlmanlar tərəfindən tərk olunması islam ümmətini günbəgün fəlakət və zillət halına salır, gərək, islam ümməti yenidən şüurlanıb və bəsirət sahibi olub zəmanənin şərtlərinə fikir versinlər, Qurani-Şərifin möhkəm ehkamlarını tərk etməyin ziyanını anlayıb, ona əməl etməyin faydasını dərk etsinlər. Düşün! Təfəkkür et! Ey qardaş! Dediklərimdən qafil olma! Allah qafil olanları heç sevməz!...



## əl-ƏNKƏBUT SURƏSİ

29-cu surədir. Məkkədə nazil olub, 69 ayə, 980 kəlmə, 4165 hərfdir.



بِسْمِ اللّٰهِ الرَّحْمٰنِ الرَّحِيمِ. الٓمّٓ ﴿١﴾ اَحَسِبَ النَّاسُ اَنْ يُتْرَكُوٓا اَنْ يَقُولُوٓا اٰمَنَّا وَهُمْ لَا يُفْتَنُونَ ﴿٢﴾
وَلَقَدْ فَتَنَّا الَّذٖينَ مِنْ قَبْلِهِمْ فَلَيَعْلَمَنَّ اللّٰهُ الَّذٖينَ صَدَقُوا وَلَيَعْلَمَنَّ الْكَاذِبٖينَ ﴿٣﴾ اَمْ حَسِبَ الَّذٖينَ
يَعْمَلُونَ السَّيِّئَاتِ اَنْ يَسْبِقُونَاؕ سَٓاءَ مَا يَحْكُمُونَ ﴿٤﴾ مَنْ كَانَ يَرْجُوا لِقَٓاءَ اللّٰهِ فَاِنَّ اَجَلَ اللّٰهِ لَاٰتٍؕ
وَهُوَ السَّمٖيعُ الْعَلٖيمُ ﴿٥﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1)** (الٓمّٓ) **- bu mübarək surənin adıdır.**

**2)** (اَحَسِبَ النَّاسُ اَنْ يُتْرَكُوٓا اَنْ يَقُولُوٓا اٰمَنَّا وَهُمْ لَا يُفْتَنُونَ) – (islama daxil olan) **insanlar** – (Qurana) **iman gətirdik, deməklə onlardan əl çəkilib** (imanlarından) **imtahan olunmayacaqlarınımı zənn edirlər?** (Əksinə, Allah-Təala onları min cür bəlaya və müsibətlərə düçar etməklə imtahan edəcəkdir. Belə ki, sadiq yalançıdan, ixlaslı riyakardan, imanı möhkəm olan zəif imanlıdan fərqlənib seçilsin. Bu ayə Məkkədə islama daxil olandan sonra müşriklərin əziyyət etdiyi bir neçə nəfər haqqında nazil olubdur, onlardan biri də Əmmar ibn Yasir idi)**.**

**3)** (وَلَقَدْ فَتَنَّا الَّذٖينَ مِنْ قَبْلِهِمْ) **- həqiqətən, onlardan əvvəlki** (peyğəmbərləri və qövmlərini də islama girənlər kimi) **imtahan etdik.** (فَلَيَعْلَمَنَّ اللّٰهُ الَّذٖينَ صَدَقُوا) **- belə ki,** (o imtahan səbəbinə) **Allah-Təala** (imanlarında) **doğru olanlara agah olsun.** (وَلَيَعْلَمَنَّ الْكَاذِبٖينَ) **- və yenə** (Allah-Təala imanlarında) **yalançı olanları bilsin.**

**4)** (اَمْ حَسِبَ الَّذٖينَ يَعْمَلُونَ السَّيِّئَاتِ اَنْ يَسْبِقُونَا) – **yoxsa pis** (günah) **əməllər edib** (bizə şərik qoşanlar) **bizdən əvvələ keçib** (əzabımızdan qurtulacaqlarınımı) **zənn edirlər?** (سَٓاءَ مَا يَحْكُمُونَ) – (günahkarlar öz zənləri ilə) **nə pis hökm edirlər,** (Allah-Təalanı aciz zənn edirlər?)

**5)** (مَنْ كَانَ يَرْجُوا لِقَٓاءَ اللّٰهِ) **- kim** (qiyamət günündə) **Allah-Təalanın** (lütf və kəraməti ilə) **qarşılaşacağına ümid etsə,** (فَاِنَّ اَجَلَ اللّٰهِ لَاٰتٍ) **- həqiqətən,** (bilsin ki,) **Allah-Təalanın təyin etdiyi əcəl** (ölüm) **gəlib onu tutacaqdır.** (Bu səbəbdən, gərək, tələsib saleh əməl etsin ki, ümid etdiyi savaba qovuşsun)**.** (وَهُوَ السَّمٖيعُ الْعَلٖيمُ) – (Allah-Təala bəndələrinin hər bir sözünü) **eşidib,** (əməllərinə də)

وَمَنْ جَاهَدَ فَاِنَّمَا يُجَاهِدُ لِنَفْسِهٖۜ اِنَّ اللّٰهَ لَغَنِيٌّ عَنِ الْعَالَمِينَ ﴿٦﴾ وَالَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ
لَنُكَفِّرَنَّ عَنْهُمْ سَيِّـَٔاتِهِمْ وَلَنَجْزِيَنَّهُمْ اَحْسَنَ الَّذِي كَانُوا يَعْمَلُونَ ﴿٧﴾ وَوَصَّيْنَا الْاِنْسَانَ بِوَالِدَيْهِ
حُسْنًاۜ وَاِنْ جَاهَدَاكَ لِتُشْرِكَ بِي مَا لَيْسَ لَكَ بِهٖ عِلْمٌ فَلَا تُطِعْهُمَاۜ اِلَيَّ مَرْجِعُكُمْ فَاُنَبِّئُكُمْ بِمَا كُنْتُمْ
تَعْمَلُونَ ﴿٨﴾ وَالَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ لَنُدْخِلَنَّهُمْ فِي الصَّالِحِينَ ﴿٩﴾ وَمِنَ النَّاسِ مَنْ
يَقُولُ اٰمَنَّا بِاللّٰهِ فَاِذَٓا اُوذِيَ فِي اللّٰهِ جَعَلَ فِتْنَةَ النَّاسِ كَعَذَابِ اللّٰهِۜ وَلَئِنْ جَٓاءَ نَصْرٌ مِنْ رَبِّكَ لَيَقُولُنَّ اِنَّا
كُنَّا مَعَكُمْۜ

---

**agah olandır,** (heç bir şey də ona məxfi deyildir, belə Allah-Təaladan qorxub saleh əməl etmək lazım deyilmi?)

**6)** (وَمَنْ جَاهَدَ فَاِنَّمَا يُجَاهِدُ لِنَفْسِهٖ) **- kim** (öz nəfsinin istəklərinə mane olub, ona qarşı) **cihad etsə, həqiqətən, o, öz** (mənfəəti) **üçün cihad edibdir,** (çünki nəfsani arzulara qarşı çıxıb, Allah-Təalanın əmrlərinə tabe olmaq insanın özünə faydalıdır). (اِنَّ اللّٰهَ لَغَنِيٌّ عَنِ الْعَالَمِينَ) **- həqiqətən, Allah-Təala aləmlərə möhtac deyil,** (Allah-Təalanın əmr və qadağaları bəndələrinə olan mərhəməti və faydasından ötrüdür).

**7)** (وَالَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ) **- o şəxslər ki, iman edib saleh əməl edir,** (لَنُكَفِّرَنَّ عَنْهُمْ سَيِّـَٔاتِهِمْ) **- onların bu saleh əməllərinə görə, günahlarını örtüb,** (silərik). (وَلَنَجْزِيَنَّهُمْ اَحْسَنَ الَّذِي كَانُوا يَعْمَلُونَ) **– etdikləri əməllərə də ən gözəl şəkildə mükafat verərik.**

**8)** (وَوَصَّيْنَا الْاِنْسَانَ بِوَالِدَيْهِ حُسْنًا) – (ey Məhəmməd), **insana tövsiyə** (əmr) **etdik ki, ata-anasına yaxşılıq edib** (gözəl rəftar və itaət etsin, ancaq Allah-Təalaya şərik qoşmaqda ata-anaya itaət etmək caiz deyil). (وَاِنْ جَاهَدَاكَ لِتُشْرِكَ بِي مَا لَيْسَ لَكَ بِهٖ عِلْمٌ) **- əgər** (atan, anan) **bilmədiyin bir şeyi mənə şərik qoşmağa cəhd etsələr** (heç bir şey mənə şərik olmağa layiq deyil). (فَلَا تُطِعْهُمَا)– (o zaman) **onlara itaət etmə).** (اِلَيَّ مَرْجِعُكُمْ) **- hamınızın dönüşü mənədir.** (Məndən qorxub şirk qoşmayın). (فَاُنَبِّئُكُمْ بِمَا كُنْتُمْ تَعْمَلُونَ) – (o vaxt) **etdiyiniz əməlləri sizə xəbər verib** (əməllərinizin cəzasını da verərəm).

**9)** (وَالَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ) **- o şəxslər ki, iman gətirib saleh əməl edir,** (لَنُدْخِلَنَّهُمْ فِي الصَّالِحِينَ) **- əlbəttə, onları saleh şəxslərin zümrəsinə daxil edərik.**

**10)** (وَمِنَ النَّاسِ مَنْ يَقُولُ اٰمَنَّا بِاللّٰهِ) **– insanlardan eləsi də var ki, biz Allah-Təalaya iman gətirdik – deyirlər,** (فَاِذَٓا اُوذِيَ فِي اللّٰهِ جَعَلَ فِتْنَةَ النَّاسِ كَعَذَابِ اللّٰهِ) – **amma** (müşriklər tərəfindən) **əziyyət edildikdə, insanların fitnə-fəsadını Allah-Təalanın əzabı kimi qəbul edərlər,** (yəni necə ki mömin şəxs Allah-Təalanın əzabından qorxub, dinindən dönüb kafir olmaz, hətta daha çox iman edər, habelə bəzi zəif imanlılar da müşriklərin əziyyətinə düçar olduqda qorxudan imandan dönüb kafir olarlar). (وَلَئِنْ جَٓاءَ نَصْرٌ مِنْ رَبِّكَ لَيَقُولُنَّ اِنَّا كُنَّا مَعَكُمْ) - (ey

**اَوَلَيْسَ اللّٰهُ بِاَعْلَمَ بِمَا فٖي صُدُورِ الْعَالَمٖينَ ﴿١٠﴾ وَلَيَعْلَمَنَّ اللّٰهُ الَّذٖينَ اٰمَنُوا وَلَيَعْلَمَنَّ الْمُنَافِقٖينَ ﴿١١﴾ وَقَالَ الَّذٖينَ كَفَرُوا لِلَّذٖينَ اٰمَنُوا اتَّبِعُوا سَبٖيلَنَا وَلْنَحْمِلْ خَطَايَاكُمْ وَمَا هُمْ بِحَامِلٖينَ مِنْ خَطَايَاهُمْ مِنْ شَيْءٍ اِنَّهُمْ لَكَاذِبُونَ ﴿١٢﴾**

---

Məhəmməd), **əgər sənin rəbbin Allah-Təaladan** (müsəlmanlara) **bir zəfər** (və var-dövlət) **gəlsə, o vaxt** (münafiqlər) **– biz sizinlə olub** (dinimizdən qayıtmamışıq, bizə də qənimət verin)**, deyərlər.** (اَوَلَيْسَ اللّٰهُ بِاَعْلَمَ بِمَا فٖي صُدُورِ الْعَالَمٖينَ) **– məgər Allah-Təala aləmlərdəki** (məxluqatın) **qəlblərindəki** (sirlərə) **agah deyilmi?** (Əlbəttə, agahdır, münafiqlər yalandan iman etdik deyirlər. Belə ki, cihad vaxtı qənimətdən onlara da pay verəsiniz. Bu surə Məkkədə nazil olub, bu ayədə Allah-Təala Hz. Peyğəmbər Mədinəyə hicrət edəndən sonra oradakı münafiqlərin əhvalını xəbər verir. Bu xəbərin doğruluğu Hz. Peyğəmbərin haqq və sadiq olduğuna dəlildir)**.**

**11)** (وَلَيَعْلَمَنَّ اللّٰهُ الَّذٖينَ اٰمَنُوا) **- əlbəttə, Allah-Təala iman gətirənləri bilir,** (وَلَيَعْلَمَنَّ الْمُنَافِقٖينَ) **- və əlbəttə, münafiq şəxsləri də tanıyır,** (necə yalan dediklərini bilir)**.**

**12)** (وَقَالَ الَّذٖينَ كَفَرُوا لِلَّذٖينَ اٰمَنُوا اتَّبِعُوا سَبٖيلَنَا) **- və kafir olanlar iman gətirənlərə dedilər:** (islamdan dönüb)**, bizim yolumuza** (və dinimizə) **tabe olun.** (وَلْنَحْمِلْ خَطَايَاكُمْ) – (Məhəmmədin dediyi qiyamət və dirilmə, əzab və savab yoxdur, əgər olsa) **günahlarınızı biz* yüklənərik.** (Bu sözü Məkkədə Qüreyşin müşrik əyanları möminlərə deyirdilər, Allah-Təala onların cavabında buyurur:) (وَمَا هُمْ بِحَامِلٖينَ مِنْ خَطَايَاهُمْ مِنْ شَيْءٍ) – (əsla)**, onların günahlarından heç bir şeyi yüklənməzlər.** (اِنَّهُمْ لَكَاذِبُونَ) **- həqiqətən, onlar** (bu sözlərində) **əlbəttə yalançıdırlar.**

*(***Qeyd:** Necə ki müşriklərin əyanları möminlərə: "Gəlin bizim dinimizə qayıdın, əgər bir günah olsa, biz ona zaminik", deyirdilər, habelə bizim dövrdə də özlərini islam rəhbəri sayanlar: "Filan işi et, bir günahı olsa, mənim boynumadır, qiyamət günü əziyyətə düçar olmağına mane olaram", -deyirlər. Avam müsəlmanları aldadanlar belə şəxslərdir. Bu səbəbdən də avam camaatın bir alimin və ya bir seyidin hüzuruna gedib, onunla bir-iki söz danışandan sonra deyir: "Qiyamət günü şəfaətinizə ümidvarıq." Bu biçarələr də bununla qürurlanıb ləzzət alırlar. Amma avam camaat daha düşünmür ki, onlar nə ixtiyarın sahibləridirlər ki, şəfaət edə bilsinlər. Həşəvi (zahiri) üləmasından biri Abbasi xəlifələrindən Mənsura ehtiyacını ərz edib istədiyini alandan sonra dedi: "Ey əmirəl-möminin, böyük bir ehtiyacımız da qaldı." Mənsur dedi: "O nə ehtiyacdır?" Dedi: "Sənin qiyamət günü bizdən ötrü şəfaət etməyindir." Zahid Əmr ibn Übeyd də o məclisdə idi. Üzünü Mənsura tutub dedi: "Bunlardan uzaq olub sözlərinə aldanma. Oğrular çöldə yol kəsərlər, amma bunlar əmin-amanlıq yerlərdə yol kəsirlər." Aman bu yol kəsənlərdən, islam ümmətini bu hala salanlar bunlar deyilmi?)*

وَلَيَحْمِلُنَّ اَثْقَالَهُمْ وَاَثْقَالًا مَعَ اَثْقَالِهِمْ وَلَيُسْـَٔلُنَّ يَوْمَ الْقِيٰمَةِ عَمَّا كَانُوا يَفْتَرُونَ ﴿١٣﴾ وَلَقَدْ
اَرْسَلْنَا نُوحًا اِلٰى قَوْمِهِ فَلَبِثَ فِيهِمْ اَلْفَ سَنَةٍ اِلَّا خَمْسِينَ عَامًا فَاَخَذَهُمُ الطُّوفَانُ وَهُمْ ظَالِمُونَ
﴿١٤﴾ فَاَنْجَيْنَاهُ وَاَصْحَابَ السَّفِينَةِ وَجَعَلْنَاهَا اٰيَةً لِلْعَالَمِينَ ﴿١٥﴾ وَاِبْرٰهِيمَ اِذْ قَالَ لِقَوْمِهِ
اعْبُدُوا اللّٰهَ وَاتَّقُوهُ ذٰلِكُمْ خَيْرٌ لَكُمْ اِنْ كُنْتُمْ تَعْلَمُونَ ﴿١٦﴾ اِنَّمَا تَعْبُدُونَ مِنْ دُونِ اللّٰهِ اَوْثَانًا
وَتَخْلُقُونَ اِفْكًا

---

**13)** (وَلَيَحْمِلُنَّ اَثْقَالَهُمْ) – (bu sözləri möminlərə deyən müşriklər qiyamət günü) **ancaq öz günahlarını yüklənib** (çəkərlər), (وَاَثْقَالًا مَعَ اَثْقَالِهِمْ)- **və öz günahları ilə birlikdə** (möminlərin günahlarına zamin olmaqdan başqa, bir də zəlalətə saldıqlarının) **günahlarını da yüklənərlər,** (وَلَيُسْـَٔلُنَّ يَوْمَ الْقِيٰمَةِ عَمَّا كَانُوا يَفْتَرُونَ) - **və əlbəttə,** (kafirlər Allah-Təalaya) **etdikləri iftiralara, görə qiyamət günündə sorğu-sual olunacaqlar.**

**14)** (وَلَقَدْ اَرْسَلْنَا نُوحًا اِلٰى قَوْمِهِ) - (bundan sonra Allah-Təala Hz. Məhəmmədə (ə.s), təsəlli verməkdən ötrü bəzi peyğəmbərlərin qissələrini zikr edir:) **həqiqətən, biz Nuhu öz qövmünə** (peyğəmbər) **göndərdik.** (Bu ayədən anlaşılır ki, Nuh Hz. İbrahim və Hz. Məhəmməd əs., kimi bütün dünyaya yox, ancaq öz qövmünə göndərilib. Qurani-Şərifin ayələri də bu mətləbə dəlildir. Bu səbəbdən Nuh tufanı onun yaşadığı yerdə meydana gəlib, Nuh qövmü də bundan həlak oldu. Təfsirçilərin və tarixçilərin: “Bütün dünyanı su basıb, bütün insanlıq suda qərq olub həlak oldu”, -sözü mənasız və Qurana zidd sözlərdir)**.** (فَلَبِثَ فِيهِمْ اَلْفَ سَنَةٍ اِلَّا خَمْسِينَ عَامًا) – (Nuh öz qövmünün) **arasında min ildən 50** (il) **əskik qalıb** (onları dəvət etdi, bu qədər çox müddətə ancaq çox az insan ona iman gətirdi. Gəmiyə minərkən Nuhun oğulları və ona iman gətirənlərin ümumi sayı cəmi 80 nəfər idi)**.** (فَاَخَذَهُمُ الطُّوفَانُ وَهُمْ ظَالِمُونَ) – (Nuhun qövmü iman gətirməyib, müşrik və) **zalım olduqları halda, tufan onları yaxaladı** (və həlak oldular)**.**

**15)** (فَاَنْجَيْنَاهُ وَاَصْحَابَ السَّفِينَةِ) – (Nuha) **və gəmidə olanlara** (tufandan) **nicat verdik.** (وَجَعَلْنَاهَا اٰيَةً لِلْعَالَمِينَ) – **və** (o gəmini və onda olan şəxslərin nicat tapmasını) **aləmlərdən ötrü** (tövhid və qüdrətimizə) **bir dəlil və sübut etdik.**

**16)** (وَاِبْرٰهِيمَ اِذْ قَالَ لِقَوْمِهِ اعْبُدُوا اللّٰهَ وَاتَّقُوهُ) - (ey Məhəmməd, İbrahimi yadına sal)**, bir zaman qövmünə demişdi: “Ancaq Allah-Təalaya ibadət** (və itaət) **edib, ondan qorxun,** (ذٰلِكُمْ خَيْرٌ لَكُمْ اِنْ كُنْتُمْ تَعْلَمُونَ) - **əgər** (xeyir və şəri tanıyıb fərqləndirəcək) **bir elm varsa,** (sizin Allah-Təalaya ibadət etməyiniz və ondan qorxmağınız) **sizin üçün daha yaxşı** (və faydalıdır)**.**

**17)** (اِنَّمَا تَعْبُدُونَ مِنْ دُونِ اللّٰهِ اَوْثَانًا) - **həqiqətən, siz Allah-Təalanı qoyub** (öz düzəltdiyiniz) **bütlərə ibadət edirsiniz,** (aqil şəxs belə etməz), (وَتَخْلُقُونَ اِفْكًا) -

اِنَّ الَّذٖينَ تَعْبُدُونَ مِنْ دُونِ اللّٰهِ لَا يَمْلِكُونَ لَكُمْ رِزْقًا فَابْتَغُوا عِنْدَ اللّٰهِ الرِّزْقَ وَاعْبُدُوهُ وَاشْكُرُوا
لَهُۜ اِلَيْهِ تُرْجَعُونَ ﴿١٧﴾ وَاِنْ تُكَذِّبُوا فَقَدْ كَذَّبَ اُمَمٌ مِنْ قَبْلِكُمْۜ وَمَا عَلَى الرَّسُولِ اِلَّا الْبَلَاغُ الْمُبٖينُ
﴿١٨﴾ اَوَلَمْ يَرَوْا كَيْفَ يُبْدِئُ اللّٰهُ الْخَلْقَ ثُمَّ يُعٖيدُهُۜ اِنَّ ذٰلِكَ عَلَى اللّٰهِ يَسٖيرٌ ﴿١٩﴾ قُلْ سٖيرُوا فِي الْاَرْضِ
فَانْظُرُوا كَيْفَ بَدَاَ الْخَلْقَ ثُمَّ اللّٰهُ يُنْشِئُ النَّشْاَةَ الْاٰخِرَةَۜ اِنَّ اللّٰهَ عَلٰى كُلِّ شَيْءٍ قَدٖيرٌۚ ﴿٢٠﴾ يُعَذِّبُ مَنْ
يَشَٓاءُ وَيَرْحَمُ مَنْ يَشَٓاءُۚ وَاِلَيْهِ تُقْلَبُونَ ﴿٢١﴾ وَمَٓا اَنْتُمْ بِمُعْجِزٖينَ فِي الْاَرْضِ وَلَا فِي السَّمَٓاءِۘ وَمَا لَكُمْ
مِنْ دُونِ اللّٰهِ مِنْ وَلِيٍّ وَلَا نَصٖيرٍ ﴿٢٢﴾

---

**yalandan uydurub** (tanrı deyirsiniz). (اِنَّ الَّذٖينَ تَعْبُدُونَ مِنْ دُونِ اللّٰهِ لَا يَمْلِكُونَ لَكُمْ رِزْقًا) **- həqiqətən, Allah-Təaladan başqa, ibadət etdikləriniz sizə ruzi verməyə qadir deyildir.** (Ruzini verən ancaq Allah-Təaladır). (فَابْتَغُوا عِنْدَ اللّٰهِ الرِّزْقَ)**- ruzini Allah-Təaladan istəyin,** (çünki ruzi verməyə qadir olan Odur). (وَاعْبُدُوهُ وَاشْكُرُوا) (لَهُ اِلَيْهِ تُرْجَعُونَ) **- Ona ibadət edib** (müvəhhid olun və ruzi verdiyi üçün) **Ona şükür edin,** (qiyamət günü) **hamınız Ona döndürüləcəksiniz."**

**18)** (وَاِنْ تُكَذِّبُوا فَقَدْ كَذَّبَ اُمَمٌ مِنْ قَبْلِكُمْ) **-** (bu ayə və bundan sonra gələn ayələrin hamısı Hz. İbrahimin kəlamıdır:) **ey camaat, əgər** (məni) **təkzib etsəniz,** (mənə bir zərəri yoxdur)**, həqiqətən, sizdən əvvəlki ümmətlər də** (Nuh, İdris, Şitin qövmləri də öz peyğəmbərlərini təkzib etmişdilər). (وَمَا عَلَى الرَّسُولِ اِلَّا) (الْبَلَاغُ الْمُبٖينُ) **- peyğəmbərin vəzifəsi ancaq** (Allah-Təalanın hökmlərini camaata) **açıq-aşkar təbliğ etməkdir,** (qalan hər şey Allah-Təalanın ixtiyarındadır).

**19)** (اَوَلَمْ يَرَوْا كَيْفَ يُبْدِئُ اللّٰهُ الْخَلْقَ ثُمَّ يُعٖيدُهُ) – (siz və sizdən əvvəlkilər) **bəs baxıb görmürlər ki, Allah-Təala** (öz qüdrəti ilə) **məxluqatı necə yaradıb,** (öləndən) **sonra necə təkrar diriltdir?** (اِنَّ ذٰلِكَ عَلَى اللّٰهِ يَسٖيرٌ) **- həqiqətən, bu** (insanları diriltdib məhşərə gətirmək) **Allah-Təala üçün çox asandır.**

**20)** (قُلْ سٖيرُوا فِي الْاَرْضِ فَانْظُرُوا كَيْفَ بَدَاَ الْخَلْقَ) **-** (Allah-Təala buyurur: "Ey İbrahim, xalqa) **de ki,** (əgər öz yaradılışınızdan ibrət almırsınızsa)**, yer üzündə səfər edib** (Allah-Təalanın) **məxluqatı necə yaratdığına** (və onların yurdlarına) **baxın.** (ثُمَّ اللّٰهُ يُنْشِئُ النَّشْاَةَ الْاٰخِرَةَ) – (insanlar fani olandan) **sonra Allah-Təala axirət həyatını yaradıb** (insanları diriltdəcəkdir. Ondan sonra bir yerə cəm edib haqq-hesab edəcəkdir). (اِنَّ اللّٰهَ عَلٰى كُلِّ شَيْءٍ قَدٖيرٌ) **- həqiqətən, Allah-Təala hər bir şeyə qadirdir.**

**21)** (يُعَذِّبُ مَنْ يَشَٓاءُ وَيَرْحَمُ مَنْ يَشَٓاءُ) **- Allah-Təala istədiyinə** (buna layiq olana) **əzab edər və istədiyinə** (buna layiq olana) **rəhm edər,** (وَاِلَيْهِ تُقْلَبُونَ) **– dönüşünüz Onadır.**

**22)** (وَمَٓا اَنْتُمْ بِمُعْجِزٖينَ فِي الْاَرْضِ وَلَا فِي السَّمَٓاءِ) **- nə yerdə, nə də səmada** (olsanız da) **Allah-Təalanı aciz edib,** (onun əzabından qurtulan deyilsiniz). (وَمَا لَكُمْ مِنْ) (دُونِ اللّٰهِ مِنْ وَلِيٍّ وَلَا نَصٖيرٍ) **- Allah-Təaladan başqa nə bir haminiz, nə də bir köməkçiniz yoxdur,** (gərək, hər bir işinizdə Ondan yardım istəyəsiniz).

وَالَّذٖينَ كَفَرُوا بِاٰيَاتِ اللّٰهِ وَلِقَائِهٖٓ اُو۬لٰٓئِكَ يَئِسُوا مِنْ رَحْمَتٖي وَاُو۬لٰٓئِكَ لَهُمْ عَذَابٌ اَلٖيمٌ ﴿٢٣﴾ فَمَا كَانَ
جَوَابَ قَوْمِهٖٓ اِلَّآ اَنْ قَالُوا اقْتُلُوهُ اَوْ حَرِّقُوهُ فَاَنْجٰيهُ اللّٰهُ مِنَ النَّارِ اِنَّ فٖي ذٰلِكَ لَاٰيَاتٍ لِقَوْمٍ يُؤْمِنُونَ
﴿٢٤﴾ وَقَالَ اِنَّمَا اتَّخَذْتُمْ مِنْ دُونِ اللّٰهِ اَوْثَانًاۙ مَوَدَّةَ بَيْنِكُمْ فِي الْحَيٰوةِ الدُّنْيَاۚ ثُمَّ يَوْمَ الْقِيٰمَةِ يَكْفُرُ
بَعْضُكُمْ بِبَعْضٍ وَيَلْعَنُ بَعْضُكُمْ بَعْضًاۘ وَمَأْوٰيكُمُ النَّارُ وَمَا لَكُمْ مِنْ نَاصِرٖينَۗ ﴿٢٥﴾ فَاٰمَنَ لَهُ لُوطٌۘ
وَقَالَ اِنّٖي مُهَاجِرٌ اِلٰى رَبّٖيۜ اِنَّهُ هُوَ الْعَزٖيزُ الْحَكٖيمُ ﴿٢٦﴾

---

**23)** (وَالَّذٖينَ كَفَرُوا بِاٰيَاتِ اللّٰهِ وَلِقَائِهٖٓ) **- o şəxslər ki, Allah-Təalanın ayələrini və** (qiyamət günündə onun əzab və rəhmətilə) **qarşılaşmağı inkar edirlər,** (اُو۬لٰٓئِكَ يَئِسُوا مِنْ رَحْمَتٖي) – (ey İbrahim,) **o şəxslər mənim** (Allahın) **rəhmətimdən ümidsiz olarlar.** (Mənim rəhmətim onlara şamil olmaz). (وَاُو۬لٰٓئِكَ لَهُمْ عَذَابٌ اَلٖيمٌ) – (qiyamət günü) **onlardan ötrü şiddətli əzab vardır.** (Hz. İbrahimin qövmünə olan nəsihəti bitdi, bundan sonra qövmü ona cavab verir)

**24)** (فَمَا كَانَ جَوَابَ قَوْمِهٖٓ اِلَّآ اَنْ قَالُوا اقْتُلُوهُ اَوْ حَرِّقُوهُ) – (ey Məhəmməd)**, qövmünün** (İbrahimə) **cavabı ancaq bu oldu,** (bir-biriləri ilə məşvərət edib) **dedilər: "Ya gərək onu öldürək, ya da** (oda salıb) **yandıraq."** (Axırda İbrahimi yandırmağa qərar verib oda atdılar). (فَاَنْجٰيهُ اللّٰهُ مِنَ النَّارِ) **- Allah-Təala** (İbrahimə) **oddan nicat verdi.** (اِنَّ فٖي ذٰلِكَ لَاٰيَاتٍ لِقَوْمٍ يُؤْمِنُونَ) **- həqiqətən, bu** (müşriklərin İbrahimi oda salıb, Allah-Təalanın onu oddan xilas etməsində Allah-Təalanın tövhid və qüdrətinə dair) **dəlil və sübutlar var.**

**25)** (وَقَالَ اِنَّمَا اتَّخَذْتُمْ مِنْ دُونِ اللّٰهِ اَوْثَانًا) – (İbrahim oddan nicat tapandan sonra qövmünə) **dedi: "Həqiqətən, siz Allah-Təalanı qoyub bütləri özünüzə məbud etdiniz.** (مَوَدَّةَ بَيْنِكُمْ فِي الْحَيٰوةِ الدُّنْيَا) – (belə ki, o bütlərə ibadət səbəbinə) **bu dünya həyatında bir-birinizə məhəbbət bəsləyib** (müttəfiq və dost olasınız)**.** (ثُمَّ يَوْمَ الْقِيٰمَةِ يَكْفُرُ بَعْضُكُمْ بِبَعْضٍ) – (dünyadan köçəndən) **sonra isə** (o məhəbbət yox olub, qiyamət günü) **bir-birinizi inkar edəcəksiniz.** (وَيَلْعَنُ بَعْضُكُمْ بَعْضًا) – **və bir-birinizə lənət edəcəksiniz.** (وَمَأْوٰيكُمُ النَّارُ) – (amma bunlar sizə fayda verməyib) **hamınızın məskəni** (cəhənnəm) **odu olacaq.** (وَمَا لَكُمْ مِنْ نَاصِرٖينَ) – **sizə bir kömək edən də olmayacaq** (ki, Allahın əzabından sizi qorusun)**."**

**26)** (فَاٰمَنَ لَهُ لُوطٌ) – (İbrahimin qohumlarından qardaşı Haranın oğlu) **Lut ona iman gətirdi.** (وَقَالَ اِنّٖي مُهَاجِرٌ اِلٰى رَبّٖي) – (İbrahim öz qövmünün imanından ümidini kəsdikdə) **dedi: "Həqiqətən, mən, gərək, rəbbim Allah-Təala tərəfinə* hicrət edib** (onların arasından çıxıb gedəm)**,** (اِنَّهُ هُوَ الْعَزٖيزُ الْحَكٖيمُ) **- həqiqətən,** (Allah-Təala məxluqata) **qalib** (olub düşmənlərindən intiqam alıb) **hikmət üzrə** (ehkam verəndir)**."**

وَوَهَبْنَا لَهُ اِسْحٰقَ وَيَعْقُوبَ وَجَعَلْنَا فِي ذُرِّيَّتِهِ النُّبُوَّةَ وَالْكِتَابَ وَاٰتَيْنَاهُ اَجْرَهُ فِي الدُّنْيَاۚ وَاِنَّهُ فِي الْاٰخِرَةِ لَمِنَ الصَّالِحِينَ ﴿٢٧﴾ وَلُوطًا اِذْ قَالَ لِقَوْمِه۪ٓ اِنَّكُمْ لَتَأْتُونَ الْفَاحِشَةَۘ مَا سَبَقَكُمْ بِهَا مِنْ اَحَدٍ مِنَ الْعَالَمِينَ ﴿٢٨﴾ اَئِنَّكُمْ لَتَأْتُونَ الرِّجَالَ وَتَقْطَعُونَ السَّبِيلَ وَتَأْتُونَ فِي نَادِيكُمُ الْمُنْكَرَۜ فَمَا كَانَ جَوَابَ قَوْمِه۪ٓ اِلَّٓا اَنْ قَالُوا ائْتِنَا بِعَذَابِ اللّٰهِ اِنْ كُنْتَ مِنَ الصَّادِقِينَ ﴿٢٩﴾ قَالَ رَبِّ انْصُرْنِي عَلَى الْقَوْمِ الْمُفْسِدِينَ ﴿٣٠﴾ وَلَمَّا جَٓاءَتْ رُسُلُنَٓا اِبْرٰهِيمَ بِالْبُشْرٰىۙ قَالُوٓا اِنَّا مُهْلِكُوٓا اَهْلِ هٰذِهِ الْقَرْيَةِۚ اِنَّ اَهْلَهَا كَانُوا ظَالِمِينَۚ ﴿٣١﴾

---

*(*Qeyd: Hz. İbrahim Kufə ətrafındakı Kusa adlı bir yerdə - Nəmrudun paytaxtında yaşayırdı. Oradan hicrət edib Harrana getdi. Bir müddət orada qaldı, sonra oradan hicrət edib gedib Fələstində məskun oldu).*

**27)** (وَوَهَبْنَا لَهُٓ اِسْحٰقَ وَيَعْقُوبَ) – (İbrahimə arvadı Saradan) **İshaqı və** (İshaqdan) **Yaqubu bəxş edib,** (وَجَعَلْنَا فِي ذُرِّيَّتِهِ النُّبُوَّةَ وَالْكِتَابَ) – (Allah-Təala tərəfindən İbrahimin) **nəslinə peyğəmbərlik və kitab da verdik.** (وَاٰتَيْنَاهُ اَجْرَهُ فِي الدُّنْيَا) – (İbrahimə) **dünyada mükafatını verdik,** (hər bir millət onu sevib təşəkkür edir)**,** (وَاِنَّهُ فِي الْاٰخِرَةِ لَمِنَ الصَّالِحِينَ) **- həqiqətən,** (İbrahim) **axirətdə də saleh şəxslərdən olacaq.**

**28)** (وَلُوطًا) - (ey Məhəmməd)**, Lutu da** (yadına sal)**.** (اِذْ قَالَ لِقَوْمِه۪ٓ اِنَّكُمْ لَتَأْتُونَ الْفَاحِشَةَ) **– bir zaman öz qövmünə** (Sodom camaatına) **demişdi: "Həqiqətən, siz qəbih əməl edirsiniz,** (مَا سَبَقَكُمْ بِهَا مِنْ اَحَدٍ مِنَ الْعَالَمِينَ) **– sizdən əvvəl aləmlərdən heç kim bunu etməyib.**

**29)** (اَئِنَّكُمْ لَتَأْتُونَ الرِّجَالَ وَتَقْطَعُونَ السَّبِيلَ) – (nə qəbih əməl edirsiniz?) **Kişilərə** (şəhvətlə) **yaxınlaşıb, yol kəsib** (müsafirləri soyursunuz?) (وَتَأْتُونَ فِي نَادِيكُمُ الْمُنْكَرَ) **- və məclislərinizdə qəbih iş görürsünüz?** (فَمَا كَانَ جَوَابَ قَوْمِه۪ٓ اِلَّا اَنْ قَالُوا ائْتِنَا بِعَذَابِ اللّٰهِ اِنْ كُنْتَ مِنَ الصَّادِقِينَ) – (Lut) **qövmünün cavabı ancaq bu oldu, dedilər: "Əgər** (ilahi əzabı vəd etmədə) **doğru deyənlərdənsənsə, Allah-Təalanın əzabını bizə gətir** (ki, bizi yaxalasın." (Lutun yalançı olduğunu zənn edib bu sözü dedilər)**.**

**30)** (قَالَ رَبِّ انْصُرْنِي عَلَى الْقَوْمِ الْمُفْسِدِينَ) – (Lut qövmünün fəsad və tüğyanlarını görüb onların iman etməsindən ümidini kəsdikdə dua edib) **dedi: "Rəbbim, mənə kömək ol. Bu fəsadçı qövmə** (əzab göndərməklə mənim sözümü təsdiq edib məni onlara qalib et)**."**

**31)** (وَلَمَّا جَٓاءَتْ رُسُلُنَٓا اِبْرٰهِيمَ بِالْبُشْرٰى) **– elçilərimiz** (olan mələklər İshaqla) **müjdələmək üçün İbrahimə gəldikdə,** (قَالُوٓا اِنَّا مُهْلِكُوٓا اَهْلِ هٰذِهِ الْقَرْيَةِ اِنَّ اَهْلَهَا كَانُوا ظَالِمِينَ) – (İbrahimə müjdəni verəndən) **sonra dedilər: "Həqiqətən,** (Allahın əmri ilə Lut) **məmləkətinin əhlini həlak edəcəyik, həqiqətən, onlar zalımdırlar."**

قَالَ اِنَّ فِيهَا لُوطًاؕ قَالُوا نَحْنُ اَعْلَمُ بِمَنْ فِيهَاؗ لَنُنَجِّيَنَّهُ وَاَهْلَهُٓ اِلَّا امْرَاَتَهُۗ كَانَتْ مِنَ الْغَابِرِينَ ﴿٣٢﴾
وَلَمَّٓا اَنْ جَٓاءَتْ رُسُلُنَا لُوطًا سِٓيءَ بِهِمْ وَضَاقَ بِهِمْ ذَرْعًا وَقَالُوا لَا تَخَفْ وَلَا تَحْزَنْ۠ اِنَّا مُنَجُّوكَ وَاَهْلَكَ اِلَّا
امْرَاَتَكَ كَانَتْ مِنَ الْغَابِرِينَ ﴿٣٣﴾ اِنَّا مُنْزِلُونَ عَلٰٓى اَهْلِ هٰذِهِ الْقَرْيَةِ رِجْزًا مِنَ السَّمَٓاءِ بِمَا كَانُوا يَفْسُقُونَ
﴿٣٤﴾ وَلَقَدْ تَرَكْنَا مِنْهَٓا اٰيَةً بَيِّنَةً لِقَوْمٍ يَعْقِلُونَ ﴿٣٥﴾ وَاِلٰى مَدْيَنَ اَخَاهُمْ شُعَيْبًاۙ فَقَالَ يَا قَوْمِ اعْبُدُوا اللّٰهَ
وَارْجُوا الْيَوْمَ الْاٰخِرَ وَلَا تَعْثَوْا فِي الْاَرْضِ مُفْسِدِينَ ﴿٣٦﴾ فَكَذَّبُوهُ فَاَخَذَتْهُمُ الرَّجْفَةُ فَاَصْبَحُوا فِي
دَارِهِمْ جَاثِمِينَۘ ﴿٣٧﴾

---

**32)** (قَالَ اِنَّ فِيهَا لُوطًا) – (İbrahim) **dedi: "**(siz deyirsiniz ki, onlar zalımdırlar, onların zülmünə görə, gərək, onları həlak edək, məsum olan) **Lut da oradadır,** (onu da həlak edəcəksiniz?)" (قَالُوا نَحْنُ اَعْلَمُ بِمَنْ فِيهَا) – (mələklər) **dedilər: "Orada olan kəslərdən biz agahıq.** (لَنُنَجِّيَنَّهُ وَاَهْلَهُٓ اِلَّا امْرَاَتَهُ)– (Luta) **və ailəsinə əzabdan nicat verəcəyik, ancaq** (Lutun) **arvadından başqa,** (كَانَتْ مِنَ الْغَابِرِينَ) **– o,** (əzab içində) **qalıb** (həlak olanlardan olacaq. Mələklər Hz. İbrahimlə vidalaşıb Lutun yanına getdilər**).**

**33)** (وَلَمَّا اَنْ جَٓاءَتْ رُسُلُنَا لُوطًا سِٓيءَ بِهِمْ) – **elçilərimiz** (olan mələklər) **Lutun yanına gəldikdə,** (insan surətində olduqları üçün Lut) **pərişan oldu.** (Qövmünün onlara sataşmasından qorxdu). (وَضَاقَ بِهِمْ ذَرْعًا) **- sıxıntıya düşüb nə edəcəyini bilmədi.** (وَقَالُوا لَا تَخَفْ وَلَا تَحْزَنْ) – (Lutun qövmü gələnlərdən xəbərdar olub Lutun evinə gəldikdə mələklər Lutun naümid olduğunu görüb ona) **dedilər: "Qorxub məhzun olma,** (biz Allah-Təalanın elçiləri və mələkləriyik), (اِنَّا مُنَجُّوكَ وَاَهْلَكَ اِلَّا امْرَاَتَكَ) **- həqiqətən, biz sənə və ailənə** (əzabdan nicat verib) **xilas edəcəyik. Ancaq arvadından başqa.** (كَانَتْ مِنَ الْغَابِرِينَ) **– o,** (əzab içində) **qalıb** (həlak olanlardan olacaq)**."**

**34)** (اِنَّا مُنْزِلُونَ عَلٰى اَهْلِ هٰذِهِ الْقَرْيَةِ رِجْزًا مِنَ السَّمَٓاءِ بِمَا كَانُوا يَفْسُقُونَ) **- həqiqətən, fasiq olduqları üçün biz bu məmləkətin** (əhlinə) **səmadan əzab** (daş) **endirəcəyik.**

**35)** (وَلَقَدْ تَرَكْنَا مِنْهَا اٰيَةً بَيِّنَةً لِقَوْمٍ يَعْقِلُونَ) **- həqiqətən, biz düşünən bir qövm üçün** (o məmləkətdən tövhid və qüdrətimizə işarə edən) **dəlil və sübutlar qoymuşuq,** (belə ki, onların məskənlərindəki izlərə baxıb ibrət alsınlar)**.**

**36)** (وَاِلٰى مَدْيَنَ اَخَاهُمْ شُعَيْبًا) **- Mədyən** (qövmünə də) **onların qardaşı Şüeybi** (peyğəmbər) **göndərdik.** (فَقَالَ يَا قَوْمِ اعْبُدُوا اللّٰهَ وَارْجُوا الْيَوْمَ الْاٰخِرَ) – (Şüeyb) **dedi: "Ey qövm, axirətə ümidvar olub,** (yaxşı əməl edib)**, Allah-Təalaya ibadət edin** (ki, nicat tapasınız). (وَلَا تَعْثَوْا فِي الْاَرْضِ مُفْسِدِينَ) **- yer üzündə fitnə-fəsad törədib, asilik edib** (Allahın itaətindən çıxmayın)**.**

**37)** (فَكَذَّبُوهُ فَاَخَذَتْهُمُ الرَّجْفَةُ) – (Şüeybi) **təkzib etdilər,** (bu səbəbdən) **zəlzələ onları yaxalayıb** (hamısı həlak oldu). (فَاَصْبَحُوا فِي دَارِهِمْ جَاثِمِينَ) – (zəlzələnin şiddətindən) **dizüstə çöküb evlərində** (həlak oldular)**.**

وَعَادًا وَثَمُودَا۟ وَقَدْ تَبَيَّنَ لَكُمْ مِنْ مَسَاكِنِهِمْۗ وَزَيَّنَ لَهُمُ الشَّيْطَانُ اَعْمَالَهُمْ فَصَدَّهُمْ عَنِ السَّبِيلِ وَكَانُوا
مُسْتَبْصِرِينَۙ ﴿٣٨﴾ وَقَارُونَ وَفِرْعَوْنَ وَهَامَانَ وَلَقَدْ جَٓاءَهُمْ مُوسٰى بِالْبَيِّنَاتِ فَاسْتَكْبَرُوا فِي الْاَرْضِ
وَمَا كَانُوا سَابِقِينَۚ ﴿٣٩﴾ فَكُلًّا اَخَذْنَا بِذَنْبِه۪ۚ فَمِنْهُمْ مَنْ اَرْسَلْنَا عَلَيْهِ حَاصِبًاۚ وَمِنْهُمْ مَنْ اَخَذَتْهُ
الصَّيْحَةُۚ وَمِنْهُمْ مَنْ خَسَفْنَا بِهِ الْاَرْضَۚ وَمِنْهُمْ مَنْ اَغْرَقْنَاۚ وَمَا كَانَ اللّٰهُ لِيَظْلِمَهُمْ وَلٰكِنْ كَانُٓوا اَنْفُسَهُمْ
يَظْلِمُونَ ﴿٤٠﴾ مَثَلُ الَّذِينَ اتَّخَذُوا مِنْ دُونِ اللّٰهِ اَوْلِيَٓاءَ كَمَثَلِ الْعَنْكَبُوتِۚ اِتَّخَذَتْ بَيْتًاۜ وَاِنَّ اَوْهَنَ
الْبُيُوتِ لَبَيْتُ الْعَنْكَبُوتِۢ لَوْ كَانُوا يَعْلَمُونَ ﴿٤١﴾

---

**38)** (وَعَادًا وَثَمُودَا۟) – (Lut və Şüeyb camaatı kimi onlardan əvvəl) **Ad və Səmud** (camaatını da həlak etdik). (وَقَدْ تَبَيَّنَ لَكُمْ مِنْ مَسَاكِنِهِمْ) – (Şama gedib-gələrkən gördüyünüz) **yurdlarından** (onları necə həlak etməyimiz) **sizə bəllidir.** (وَزَيَّنَ لَهُمُ الشَّيْطَانُ اَعْمَالَهُمْ) **- şeytan** (Ad və Səmud camaatına) **əməllərini gözəl göstərdi.** (Onlar da Allah-Təalaya şərik qoşdular). (فَصَدَّهُمْ عَنِ السَّبِيلِ) **- onları** (haqq) **yolundan çıxartdı.** (وَكَانُوا مُسْتَبْصِرِينَ) **- halbuki bəsirət sahibi idilər,** (lakin nəfsani arzulara tabe olub zəlalət içində) **qaldılar.**

**39)** (وَقَارُونَ وَفِرْعَوْنَ وَهَامَانَ) – (bu 3 nəfəri:) **Qarunu, fironu və Hamanı da biz həlak etdik,** (وَلَقَدْ جَٓاءَهُمْ مُوسٰى بِالْبَيِّنَاتِ) **- həqiqətən, Musa onlara açıq-aşkar dəlil və sübutlarla** (peyğəmbər) **gəlmişdi.** (فَاسْتَكْبَرُوا فِي الْاَرْضِ) – (Misir) **torpağında təkəbbürlənib** (Musaya tabe olmadılar). (وَمَا كَانُوا سَابِقِينَ)**– və** (Allahın əzabından da) **sovuşa bilmədilər.**

**40)** (فَكُلًّا اَخَذْنَا بِذَنْبِه۪) - (ey Məhəmməd, hər bir asi ümməti) **biz öz günahı ilə yaxalayıb** (əzabla həlak etdik). (فَمِنْهُمْ مَنْ اَرْسَلْنَا عَلَيْهِ حَاصِبًا)**– onlardan bəzisinə** (Ad camaatına) **daş yağdıran şiddətli külək göndərib** (həlak etdik). (وَمِنْهُمْ مَنْ اَخَذَتْهُ الصَّيْحَةُ) **- bəzisini** (Səmud camaatını) **şiddətli** (ildırım) **səsi yaxalayıb** (həlak etdi). (وَمِنْهُمْ مَنْ خَسَفْنَا بِهِ الْاَرْضَ) **- onlardan bəzisini də** (Qarun və Mədyən camaatını) **yerə batırdıq.** (وَمِنْهُمْ مَنْ اَغْرَقْنَا) **- bəzilərini də** (Nuh və firon qövmünü) **suya qərq etdik.** (وَمَا كَانَ اللّٰهُ لِيَظْلِمَهُمْ) **- Allah-Təala onlara zülm edən deyildi.** (وَلٰكِنْ كَانُٓوا اَنْفُسَهُمْ يَظْلِمُونَ) **- lakin onlar (Allah-Təalaya şərik qoşub peyğəmbərlərə itaət etməməklə) özlərinə zülm edib (həlak oldular).**

**41)** (مَثَلُ الَّذِينَ اتَّخَذُوا مِنْ دُونِ اللّٰهِ اَوْلِيَٓاءَ) **- özlərinə Allah-Təaladan başqa dostlar seçib,** (müşrik olanların) **məsəli,** (كَمَثَلِ الْعَنْكَبُوتِ اِتَّخَذَتْ بَيْتًا) – (ağzındakı tüpürcəklə zəif) **yuva quran hörümçəyin məsəli kimidir.** (Müşriklər də Allah-Təaladan başqasını özlərinə dost seçib ona təvəkkül etməkdə hörümçək kimidirlər). (وَاِنَّ اَوْهَنَ الْبُيُوتِ لَبَيْتُ الْعَنْكَبُوتِ) **- həqiqətən, evlərin ən zəifi hörümçəyin yuvasıdır.** (لَوْ كَانُوا يَعْلَمُونَ) **- əgər bilsəydilər,** (hörümçək yuvası kimi zəif şeylərə təvəkkül etməzdilər. Necə ola bilər ki, agah olmasınlar, halbuki hər kəs bundan agahdır, lakin inadkarlıqlarından küfr içində qalırlar).

اِنَّ اللّٰهَ يَعْلَمُ مَا يَدْعُونَ مِنْ دُونِه۪ مِنْ شَيْءٍۜ وَهُوَ الْعَز۪يزُ الْحَك۪يمُ ﴿٤٢﴾ وَتِلْكَ الْاَمْثَالُ نَضْرِبُهَا لِلنَّاسِۚ وَمَا يَعْقِلُهَٓا اِلَّا الْعَالِمُونَ ﴿٤٣﴾ خَلَقَ اللّٰهُ السَّمٰوَاتِ وَالْاَرْضَ بِالْحَقِّۜ اِنَّ ف۪ي ذٰلِكَ لَاٰيَةً لِلْمُؤْمِن۪ينَ ﴿٤٤﴾ اُتْلُ مَٓا اُو۫حِيَ اِلَيْكَ مِنَ الْكِتَابِ وَاَقِمِ الصَّلٰوةَۜ اِنَّ الصَّلٰوةَ تَنْهٰى عَنِ الْفَحْشَٓاءِ وَالْمُنْكَرِۜ

---

**42)** (اِنَّ اللّٰهَ يَعْلَمُ مَا يَدْعُونَ مِنْ دُونِه۪ مِنْ شَيْءٍ) **- həqiqətən, Allah-Təala onların** (Allahı) **qoyub nəyə dua** (və ibadət) **etdiklərini bilir** (və onu da bilir ki, Allah-Təalanın müqabilində onlar heç nədir)**.** (وَهُوَ الْعَز۪يزُ الْحَك۪يمُ) – (məxluqata) **qalib** (olan və hər şeyi) **hikmətlə edən** (ancaq Allah-Təaladır. Belə Allah-Təalanı qoyub cansız şeylərə sitayiş etmək cahillik və axmaqlıqdır)**.**

**43)** (وَتِلْكَ الْاَمْثَالُ نَضْرِبُهَا لِلنَّاسِ) - (Qüreyş camaatı dedilər: "Məhəmmədin Allahı milçək və hörümçəklə məsəl çəkir." Bu sözü deyib gülürdülər. Allah-Təala da onları rədd etmək üçün bu ayəni göndərdi:) **biz bu məsəlləri insanlardan ötrü çəkirik,** (وَمَا يَعْقِلُهَٓا اِلَّا الْعَالِمُونَ) **- amma** (o məsəllərin həqiqətini və faydasını) **aqil şəxslərdən başqası dərk etməz,** (məsəl və təşbeh kəlmənin həqiqi mənasına gedən gözəl bir yoldur. Belə ki, onun səbəbinə mənası kəşf edilsin. Məsəl çəkilən şey heyvan olsun, ya başqa bir şey, zəif olsun, ya güclü, məqsəd o deyil, məqsəd onun ehtiva etdiyi mənadır. Müşriklər cəhalətlərindən məsəlin həqiqi mənasından qafil olub onun zahirinə irad tutdular)**.**

**44)** (خَلَقَ اللّٰهُ السَّمٰوَاتِ وَالْاَرْضَ بِالْحَقِّ) **- Allah-Təala səmaları və yeri haqq** (və hikmət) **üzrə yaratdı.** (Belə ki, insanlardan ötrü onun əzəmət və qüdrətinə dəlil və sübut olsunlar)**.** (اِنَّ ف۪ي ذٰلِكَ لَاٰيَةً لِلْمُؤْمِن۪ينَ) **- həqiqətən, bu** (səmaların və yerin yaradılmasında Allah-Təalanın tövhid və qüdrətinə dair) **möminlərdən ötrü dəlil və sübutlar var.**

**45)** (اُتْلُ مَٓا اُو۫حِيَ اِلَيْكَ مِنَ الْكِتَابِ) (ey Məhəmməd)**,** (Qurani-Şərif) **kitabından sənə vəhy olunan ayələri** (ehkamları insanlara çatdırıb) **oxu,** (وَاَقِمِ الصَّلٰوةَ)**- namazı** (vaxtında) **qılıb** (tərk etmə)**.** (اِنَّ الصَّلٰوةَ تَنْهٰى عَنِ الْفَحْشَٓاءِ وَالْمُنْكَرِ) **- həqiqətən, namaz** (elə bir ibadətdir ki, insanı) **pis və çirkin əməllərdən çəkindirib** (insaf və mürüvvətə, insanlığa* sövq edər)**.**

*(***Qeyd:** *Bəs bu müsəlmanlar necə namaz qılırlar ki, daim camaatla qıldıqları halda baxıb görürsən ki, pis və qəbih əməllər edirlər. Çox vaxt hətta camaatla oturub dua etmək yerinə qeybət edib, bir-birilərinin eyiblərini zikr edib, o əsnada da gah salavat, ya da bir tövbə deyib, arxasınca: "Allahım, məni iri gözlü hurilərlə evləndir", -deyə dua edirlər. Bu təfsiri oxuyanlar zənn etməsinlər ki, mən həqir bu sözlərlə iftira və böhtan atıram. Allah özü şahiddir, ariflər də bilir ki, əsl həqiqət mən deyən kimidir. Allah qorusun, ya Allahın bu ayədə dediyi yalandır, ya da bizim qıldığımız namazlar yalandır. Ayəyə dürüst nəzər edilsə, görülər ki, əlbəttə, namaz qılan şəxs qəbih əməllərdən uzaq olmalıdır. Halbuki biz görürük ki, hətta namaz qılmayanların etmədiyi əməlləri bəzi namaz qılanlar edirlər. Namaz qılmayan Allah-Təalaya*

وَلَذِكْرُ اللّٰهِ اَكْبَرُ وَاللّٰهُ يَعْلَمُ مَا تَصْنَعُونَ ﴿٤٥﴾ وَلَا تُجَادِلُوٓا اَهْلَ الْكِتَابِ اِلَّا بِالَّتِي هِيَ اَحْسَنُ اِلَّا الَّذِينَ ظَلَمُوا مِنْهُمْ وَقُولُوٓا اٰمَنَّا بِالَّذِي اُنْزِلَ اِلَيْنَا وَاُنْزِلَ اِلَيْكُمْ وَاِلٰهُنَا وَاِلٰهُكُمْ وَاحِدٌ وَنَحْنُ لَهُ مُسْلِمُونَ ﴿٤٦﴾ وَكَذٰلِكَ اَنْزَلْنَآ اِلَيْكَ الْكِتَابَ فَالَّذِينَ اٰتَيْنَاهُمُ الْكِتَابَ يُؤْمِنُونَ بِهٖ وَمِنْ هٰٓؤُلَٓاءِ مَنْ يُؤْمِنُ بِهٖ وَمَا يَجْحَدُ بِاٰيَاتِنَآ اِلَّا الْكَافِرُونَ ﴿٤٧﴾ وَمَا كُنْتَ تَتْلُوا مِنْ قَبْلِهٖ مِنْ كِتَابٍ

---

*asi olub, cəzası Allah-Təalaya həvalədır. Amma namazı qılıb qəbih əməllər edənlərin namazı inanc üzrə olmayıb, ata-anasından gördüyü adət üzrədir. Namazın zahiri və mənəvi şərtlərinə tabe olmadan qılmaq ona istehza etməkdir, cahillərin namazı belə olduğu üçün hər cür qəbih əməllər də edirlər. Ayənin hökmünə görə də çox namaz qılanlar var ki, əslində, fasiqdirlər).*

(وَلَذِكْرُ اللّٰهِ اَكْبَرُ) - **əlbəttə, Allah-Təalanı** (həmd-səna ilə) **zikr etmək** (digər əməllərdən daha fəzilətli və) **daha böyükdür,** (çünki Allah-Təalanın zikrini ehtiva edir**).** (وَاللّٰهُ يَعْلَمُ مَا تَصْنَعُونَ) **- Allah-Təala etdiyiniz** (hər bir ibadətdən) **agahdır,** (ona görə sizə qarşılıq verəcəkdir**).**

**46)** (وَلَا تُجَادِلُوٓا اَهْلَ الْكِتَابِ اِلَّا بِالَّتِي هِيَ اَحْسَنُ) – (ey möminlər)**, kitab əhli ilə ancaq gözəl şəkildə mübahisə edin.** (Qəzəblənmələrinin müqabilində mülayimliklə yaxşı söz deyin**).** (اِلَّا الَّذِينَ ظَلَمُوا مِنْهُمْ) **- ancaq onlardan zalım olanlar istisnadır,** (qəzəblənmələrinin müqabilində şiddətlə cavab verin**).** (وَقُولُوٓا اٰمَنَّا بِالَّذِي اُنْزِلَ اِلَيْنَا وَاُنْزِلَ اِلَيْكُمْ) – (o cümlədən belə) **deyin: biz həm bizə nazil olana** (Qurana) **və həm də sizə nazil olana** (İncil və Tövrata) **iman gətirmişik.** (وَاِلٰهُنَا وَاِلٰهُكُمْ وَاحِدٌ) **- bizim Allahımız və sizin Allahınız yeganə** (olan Allah-Təaladır**).** (وَنَحْنُ لَهُ مُسْلِمُونَ) **- bizim hamımız** (Allah-Təalaya iman gətirib) **itaət edənlərik.** (Bizimlə sizin aranızda bir ixtilaf yoxdur, necə ki biz sizin kitabınızı təsdiq edirik, siz də bizim kitabımızı - Quranı təsdiq edin. Belə ki, heç bir ixtilaf qalmasın**).**

**47)** (وَكَذٰلِكَ اَنْزَلْنَآ اِلَيْكَ الْكِتَابَ) **-** (ey Məhəmməd, səndən əvvəlki peyğəmbərlərə kitab göndərdiyimiz kimi) **sənə də beləcə** (Quran) **kitabını nazil etdik,** (فَالَّذِينَ اٰتَيْنَاهُمُ الْكِتَابَ يُؤْمِنُونَ بِهٖ) **- kitab** (Tövrat) **verdiyimiz şəxslər** (yəni bəzisi siz Mədinəyə hicrət edəndən sonra Qurana) **iman gətirərlər,** (Allah-Təala bu ayədə Hz. Peyğəmbər Mədinəyə hicrət edəndən sonra ona iman gətirəcək olan yəhudiləri əvvəlcədən Məkkədə ona xəbər verir**).** (وَمِنْ هٰٓؤُلَٓاءِ مَنْ يُؤْمِنُ بِهٖ) – (bu Məkkə əhlindən də az bir qismi Hz. Peyğəmbərə iman gətirmişdilər, amma bu ayədən sonra necə ki Allah-Təala xəbər verir:) **onların** (böyüklərindən də) **iman gətirən var.** (وَمَا يَجْحَدُ بِاٰيَاتِنَآ اِلَّا الْكَافِرُونَ) **- bizim açıq-aşkar ayələrimizi** (inadkar müşriklərdən və) **kafirlərdən başqası inkar etməz.**

**48)** (وَمَا كُنْتَ تَتْلُوا مِنْ قَبْلِهٖ مِنْ كِتَابٍ) **-** (ey Məhəmməd, bu müşriklər Quranı səndən qəbul etmirlər)**, sən ki bu** (Quran) **kitabından qabaq heç** (kitab) **oxu-**

وَلَا تَخُطُّهُ بِيَمِينِكَ اِذًا لَارْتَابَ الْمُبْطِلُونَ ﴿٤٨﴾ بَلْ هُوَ اٰيَاتٌ بَيِّنَاتٌ فِي صُدُورِ الَّذِينَ اُوتُوا الْعِلْمَ وَمَا يَجْحَدُ بِاٰيَاتِنَآ اِلَّا الظَّالِمُونَ ﴿٤٩﴾

---

**yan deyildin*.** (Qüreyş camaatı özləri bilirlər ki, sən heç nə oxumayıbsan)**.** (وَلَا تَخُطُّهُ بِيَمِينِكَ) **- və sağ əlinlə də yazmağı da bilmirsən.** (Belə ki, desinlər ki, Quranı özün yazıb düzəldibsən)**.** (اِذًا لَارْتَابَ الْمُبْطِلُونَ) **- əgər belə olub** (yazıb-oxuya bilsəydin)**, batilə düşən** (müşriklər Quran haqqında) **şəkk-şübhə edib** (deyərdilər: bu Quranı sən özündən düzəldibsən. Amma bir halda ki, peyğəmbər yazıb-oxuya bilmir, ona "Quranı özün yazmısan", -demək batil sözdür)**.**

*(*Qeyd:* *Hz. Peyğəmbərin doğruluğuna və haqq olduğuna ilk dəlil onun "ümmi", yəni yazıb-oxuma bilməyən biri olmasıdır. Məkkəli müşriklərin hamısı onun ümmi olduğunu bildiklərindən yazıb-oxumağı ona isnad etməmişdilər. Allah-Təalanın bu ayədə peyğəmbərin ümmi olmasını zikr etməsindən məqsəd o həzrətin uca məqamını bəyan etməkdir. Amma bizim bəzi müsəlmanlar Allah-Təalanın Hz. Peyğəmbərdən ötrü ucalıq mərtəbəsi kimi zikr etdiyi mətləbi naqislik hesab edib, Qurana zidd fitvalar verib, hər bir dildə yazıb-oxumağı peyğəmbərə isnad ediblər. Bununla da islama düşmən olanların sözlərini təsdiq etmiş olurlar. İslama müxalif olanların bəzisi Hz. Peyğəmbərin yazıb-oxuma bildiyini, lakin öz mənfəəti üçün bunu gizlətdiyini, ancaq ömrünün sonunda vəfat edərkən bu sirrini aşkar edib: "Mənə kağız, qələm gətirin ki, məndən sonra zəlalətə vaqe olmayasınız deyə sizin üçün yazım", -deməklə onun yazıb-oxuya bildiyini qeyd ediblər. Onların bu sözləri bir neçə baxımdan qəbul edilə bilməz. Birincisi, əgər Hz. Peyğəmbər yazıb-oxuya bilsəydi, Qüreyş camaatının əlində böyük bir bəhanə olub, Quranın batil olduğunu sübut etmək üçün öncə bunu deyərdilər. Halbuki heç yerdə nəql olunmayıb ki, Qüreyş camaatı Hz. Peyğəmbərə yazıb-oxuya bilməsini irad tutmuş olsunlar. Əksinə, deyirdilər ki, bu Quranı filan şəxsdən, ya da cinlərdən, şeytanlardan öyrənmisən. Hz. Peyğəmbərin yazıb-oxuya bilmədiyindən agah olduqlarından belə deyirdilər. İkincisi, iqtidar sahibi birinin: "Gətirin sizdən ötrü yazım", -deməsi onun yazıb-oxuya bildiyinə işarə edərmi? Xeyr, iqtidar sahiblərinin danışığı elə belə olur. Çox vaxt belə savadsız şəxslər deyir ki, mən oxudum, ya da filankəsə yazdım, halbuki yazıb-oxuyan onun katibidir, habelə bir çox savadlı iqtidar sahibləri də: "Gətirin yazım", -deyir, halbuki özü yazmayıb, katibinə yazdırır. Hz. Peyğəmbərin də bu sözü yazıb-oxuya bildiyinə işarə etmir. Bizim alim cildindəki cahillərimizin də Hz. Peyğəmbərin bütün dünya dillərini yazıb-oxuya bildiyini deməl o islam düşmənlərinin sözlərinə dəlil olur. Qurani-Şərifin incəliklərini dərk edib anlamamıza Allah-Təala yardım etsin, amin!)*

**49)** (بَلْ هُوَ اٰيَاتٌ بَيِّنَاتٌ) **-** (ey Məhəmməd, bu Quranı sənə isnad etmək batildir)**, əksinə o, bizim tərəfimizdən** (haqlılığı) **aşkar olan ayələrdir.** (فِي صُدُورِ الَّذِينَ اُوتُوا الْعِلْمَ) – (bu ayələr) **elm** (və hikmət) **verilmiş kəslərin sinələrində** (bərqərar olub onun ehkamına əməl edərlər)**.** (وَمَا يَجْحَدُ بِاٰيَاتِنَآ اِلَّا الظَّالِمُونَ) **- bizim ayələrimizi zalımlardan başqası inkar etməz.**

وَقَالُوا لَوْلَٓا اُنْزِلَ عَلَيْهِ اٰيَاتٌ مِنْ رَبِّهٖۜ قُلْ اِنَّمَا الْاٰيَاتُ عِنْدَ اللّٰهِۜ وَاِنَّمَٓا اَنَا۬ نَذ۪يرٌ مُب۪ينٌ ﴿٥٠﴾ اَوَلَمْ يَكْفِهِمْ اَنَّٓا اَنْزَلْنَا عَلَيْكَ الْكِتَابَ يُتْلٰى عَلَيْهِمْۜ اِنَّ ف۪ي ذٰلِكَ لَرَحْمَةً وَذِكْرٰى لِقَوْمٍ يُؤْمِنُونَ ﴿٥١﴾ قُلْ كَفٰى بِاللّٰهِ بَيْن۪ي وَبَيْنَكُمْ شَه۪يدًاۚ يَعْلَمُ مَا فِي السَّمٰوَاتِ وَالْاَرْضِۜ وَالَّذ۪ينَ اٰمَنُوا بِالْبَاطِلِ وَكَفَرُوا بِاللّٰهِۙ اُو۬لٰٓئِكَ هُمُ الْخَاسِرُونَ ﴿٥٢﴾ وَيَسْتَعْجِلُونَكَ بِالْعَذَابِۜ وَلَوْلَٓا اَجَلٌ مُسَمًّى لَجَٓاءَهُمُ الْعَذَابُۜ وَلَيَأْتِيَنَّهُمْ بَغْتَةً وَهُمْ لَا يَشْعُرُونَ ﴿٥٣﴾ يَسْتَعْجِلُونَكَ بِالْعَذَابِۜ وَاِنَّ جَهَنَّمَ لَمُح۪يطَةٌ بِالْكَافِر۪ينَۙ ﴿٥٤﴾

---

**50)** (وَقَالُوا لَوْلَٓا اُنْزِلَ عَلَيْهِ اٰيَاتٌ مِنْ رَبِّهٖ) – (müşriklər) **dedilər:** (əgər bu Məhəmməd haqq peyğəmbərdirsə)**, niyə ona öz rəbbi Allah-Təaladan möcüzələr nazil olmur?** (Necə ki özgə peyğəmbərlərə nazil olub)**.** (قُلْ اِنَّمَا الْاٰيَاتُ عِنْدَ اللّٰهِ) **-** (ey Məhəmməd, onlara) **de ki, möcüzələr Allah-Təalanın yanında** (və onun ixtiyarındadır. Mənim ixtiyarımda deyil ki, sizdən ötrü istədiyiniz möcüzəni gətirim)**.** (وَاِنَّمَٓا اَنَا۬ نَذ۪يرٌ مُب۪ينٌ) **- həqiqətən, mən ancaq** (Allah-Təala tərəfindən onun əzabı ilə) **sizi açıq-aşkar qorxudan** (peyğəmbərəm, bundan başqa möcüzə gətirməyə qüdrətim yoxdur)**.**

**51)** (اَوَلَمْ يَكْفِهِمْ اَنَّٓا اَنْزَلْنَا عَلَيْكَ الْكِتَابَ يُتْلٰى عَلَيْهِمْ) **-** (ey Məhəmməd, bəs müşriklərə möcüzə olaraq) **bu kifayət etmir ki, sənə kitab** (Quran) **nazil etmişik?** (Sən özün ümmi olduğun halda o kitabı) **onlara oxuyursan.** (Yenə də səndən möcüzə istəyirlər?) (اِنَّ ف۪ي ذٰلِكَ لَرَحْمَةً وَذِكْرٰى لِقَوْمٍ يُؤْمِنُونَ) **- həqiqətən, bu (Quranın sənə nazil olmasında) iman gətirən camaatdan ötrü rəhmət və (Allah-Təalanın əzəmət və qüdrətini xatırladan) bir nəsihət vardır.**

**52)** (قُلْ كَفٰى بِاللّٰهِ بَيْن۪ي وَبَيْنَكُمْ شَه۪يدًا) – (ey Məhəmməd, müşriklərə) **de ki, Allah-Təala mənimlə sizin aranızda şahid olduğu halda, kifayət edər.** (Nə istəyirsiniz, edin)**.** (يَعْلَمُ مَا فِي السَّمٰوَاتِ وَالْاَرْضِ) **- səmalarda və yerdə olan hər bir şeyi Allah bilir,** (وَالَّذ۪ينَ اٰمَنُوا بِالْبَاطِلِ وَكَفَرُوا بِاللّٰهِ) **– o şəxslər ki, batil** (bütlərə) **iman gətirib Allah-Təalanı inkar edir,** (اُو۬لٰٓئِكَ هُمُ الْخَاسِرُونَ) **- onlar, əlbəttə, özlərinə ziyankar olanlardır.** (Çünki axirəti dünyaya satıb uduzublar)**.**

**53)** (وَيَسْتَعْجِلُونَكَ بِالْعَذَابِ) **–** (ey Məhəmməd)**, səndən əzabı tez** (gətirməni) **istəyirlər,** (deyirlər ki, haqlısansa, bizə əzab nazil et)**.** (وَلَوْلَٓا اَجَلٌ مُسَمًّى لَجَٓاءَهُمُ الْعَذَابُ) **– əgər onlara** (Allah-Təala tərəfindən) **müəyyən bir vaxt verilməsəydi** (və ilahi hikmətə görə o əzabın qiyamətə kimi təxirə düşməyi vacib olmasaydı)**, əlbəttə, istədikləri əzab tezliklə gələrdi.** (Allah-Təala da hikmətinə xilaf çıxmayıb əzablarını təxirə saldı)**.** (وَلَيَأْتِيَنَّهُمْ بَغْتَةً وَهُمْ لَا يَشْعُرُونَ) **- əlbəttə,** (o müəyyən vaxtda, qiyamət günündə əzab) **qəfildən onlara gələr,** (vaxtına da) **agah olmazlar.** (O əzaba düçar olub, xilas da ola bilməzlər)**.**

**54)** (يَسْتَعْجِلُونَكَ بِالْعَذَابِۜ وَاِنَّ جَهَنَّمَ لَمُح۪يطَةٌ بِالْكَافِر۪ينَ) **-** (ey Məhəmməd)**, səndən əzabı tez** (gətirməni) **istəyirlər,** (bəs kafirlər görmürlər ki,) **cəhənnəmin əzabı**

يَوْمَ يَغْشٰيهُمُ الْعَذَابُ مِنْ فَوْقِهِمْ وَمِنْ تَحْتِ اَرْجُلِهِمْ وَيَقُولُ ذُوقُوا مَا كُنْتُمْ تَعْمَلُونَ ﴿٥٥﴾ يَا
عِبَادِيَ الَّذِينَ اٰمَنُوٓا اِنَّ اَرْضِي وَاسِعَةٌ فَاِيَّايَ فَاعْبُدُونِ ﴿٥٦﴾ كُلُّ نَفْسٍ ذَٓائِقَةُ الْمَوْتِ ثُمَّ اِلَيْنَا
تُرْجَعُونَ ﴿٥٧﴾

---

**onları əhatə edib** (hamısı əzab içindədir? Yəni axirət əzabından başqa dünya əzabı da onları əhatə edib, az sonra Allah-Təala səni onlara qalib edib, ya əsir, ya öldürülmüş olarlar. Həmişə əzab cəhənnəmə isnad edilir, dünya əzabı da şiddətli olduğundan cəhənnəmə isnad edildi)**.**

**55)** (يَوْمَ يَغْشٰيهُمُ الْعَذَابُ مِنْ فَوْقِهِمْ) – (qiyamət) **günü əzab onları üstlərindən sarar,** (وَمِنْ تَحْتِ اَرْجُلِهِمْ) – (həm də) **ayaqlarının altından.** (وَيَقُولُ ذُوقُوا مَا كُنْتُمْ تَعْمَلُونَ) – (qiyamət günü müşriklərə və asilərə) **deyərik:** (dünyada) **etdiklərinizin** (cəzasını) **dadın.** (O dünyada ləzzət aldığınız kimi burada da ləzzət ala bilərsinizmi?)

**56)** (يَا عِبَادِيَ الَّذِينَ اٰمَنُوا) **- ey mənim iman gətirən bəndələrim,** (əgər düşmənlərinizin qorxusundan sizə hər hansı bir məkanda mənə ibadət edib sitayiş etmək çətin olsa, o məkanda qalmayıb oradan* hicrət edib əmin-amanlıq bir yerə gedin)**.** (اِنَّ اَرْضِي وَاسِعَةٌ فَاِيَّايَ فَاعْبُدُونِ) **- mənim yerim genişdir,** (bu səbəbdən hicrət edib başqa yerdə) **ancaq Mənə ibadət edin.**

*(*Qeyd: Hz. Peyğəmbərin səhabələrinin həyatı Məkkədə dözülməz olduqda, Hz. Peyğəmbərin əmri ilə hicrət edib Həbəşistana getdilər. Ondan sonra Hz. Peyğəmbər Mədinəyə hicrət edəndə onlar da Hz. Peyğəmbərin yanına gəldilər. Mömin şəxs, gərək, dinini belə mühafizə etsin, nəinki kiminsə sözü ilə, ya da hər hansı bir kiçik səbəblə dinindən əl çəkib gündə bir dinə qulluq etsin. Necə ki bizim bu dövrdəki müsəlmanlarda bu müşahidə olunur. Gündə bir Mehdi, bir Hüseyn ibn Əli, bir təzə dəlil peyda olur. Hz. Əli (ə.s), buyuran kimi: "Hər anqıranın dalınca gedirlər". Hər çağıranın dalınca gedən avam camaat da onlara tabe olub, islamdan üz döndərib, özlərinə başqa-başqa adlar qoyurlar. Bu zamanda bütün digər din mənsublarına islamın üstünlüyü günəş kimi sabit və aşkar olubdur. Onların üləmalarının islam barəsində yazdıqları kitablara baxdıqda bu mətləb məlum olur. Amma cahil və nadan müsəlmanlar bunun müqabilində islama tənə edib, onun bəzi ehkamlarına irad tuturlar. Bu da ancaq cəhalətdəndir. Belələri Avropa elmlərinə sahib olub, amma öz dininin ehkam və qanunundan bixəbər olduqlarından islama irad tuturlar. Beləlırinə biz cahil deyirik, hər kəs əvvəlcə öz dinini öyrənməlidir, ondan sonra digər dilləri və ona məxsus elmləri öyrənməkdə bir maneə yoxdur).*

**57)** (كُلُّ نَفْسٍ ذَٓائِقَةُ الْمَوْتِ ثُمَّ اِلَيْنَا تُرْجَعُونَ) – **hər kəs ölümün** (acılığını və məşəqqətini) **dadacaqdır.** (Öldükdən sonra da cəza və ya mükafat üçün) **bizim tərəfimizə qayıdacaqlar.** (Bu səbəbdən hər kəsə axirət günündən ötrü xeyir əməl etmək lazımdır ki, onun əvəzində Allah-Təala tərəfindən savab qazanıb nicat tapsınlar)**.**

وَالَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ لَنُبَوِّئَنَّهُمْ مِنَ الْجَنَّةِ غُرَفًا تَجْرِي مِنْ تَحْتِهَا الْاَنْهَارُ خَالِدِينَ فِيهَاۜ نِعْمَ اَجْرُ الْعَامِلِينَۗ ﴿٥٨﴾ اَلَّذِينَ صَبَرُوا وَعَلٰى رَبِّهِمْ يَتَوَكَّلُونَ ﴿٥٩﴾ وَكَاَيِّنْ مِنْ دَٓابَّةٍ لَا تَحْمِلُ رِزْقَهَاۗ اَللّٰهُ يَرْزُقُهَا وَاِيَّاكُمْۘ وَهُوَ السَّمِيعُ الْعَلِيمُ ﴿٦٠﴾ وَلَئِنْ سَاَلْتَهُمْ مَنْ خَلَقَ السَّمٰوَاتِ وَالْاَرْضَ وَسَخَّرَ الشَّمْسَ وَالْقَمَرَ لَيَقُولُنَّ اللّٰهُۚ فَاَنّٰى يُؤْفَكُونَ ﴿٦١﴾ اَللّٰهُ يَبْسُطُ الرِّزْقَ لِمَنْ يَشَٓاءُ مِنْ عِبَادِهٖ وَيَقْدِرُ لَهُۜ اِنَّ اللّٰهَ بِكُلِّ شَيْءٍ عَلِيمٌ ﴿٦٢﴾ وَلَئِنْ سَاَلْتَهُمْ مَنْ نَزَّلَ مِنَ السَّمَٓاءِ مَٓاءً فَاَحْيَا بِهِ الْاَرْضَ مِنْ بَعْدِ مَوْتِهَا

---

**58)** (وَالَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ لَنُبَوِّئَنَّهُمْ مِنَ الْجَنَّةِ غُرَفًا) - **o şəxslər ki, iman gətirib saleh əməl edir, onları cənnətdəki uca guşələrdə sakin edib** (lütf bəxş edərik)**.** (تَجْرِي مِنْ تَحْتِهَا الْاَنْهَارُ خَالِدِينَ فِيهَا) – (o cənnətin qəsrlərinin və ağaclarının) **altından çaylar axar və orada əbədi qalıb** (heç vaxt çıxmazlar)**.** (نِعْمَ اَجْرُ الْعَامِلِينَ) – (dünyada Allah-Təalanın hökmlərinə) **əməl edənlərin** (axirətdəki) **savabı necə də yaxşıdır.**

**59)** (اَلَّذِينَ صَبَرُوا وَعَلٰى رَبِّهِمْ يَتَوَكَّلُونَ) – (cənnətliklər) **o şəxslərdir ki,** (müşriklərin əziyyətlərinə) **səbir edib, rəbləri Allah-Təalaya da təvəkkül edirlər.**

**60)** (وَكَاَيِّنْ مِنْ دَٓابَّةٍ لَا تَحْمِلُ رِزْقَهَا) - (Hz. Peyğəmbər Məkkədə müsəlmanlara hicrət etməyi əmr etdi. Onlar aclıqdan qorxub dedilər: "Biz qərib vilayətə gedib orada necə yaşayacağıq? Bu ayə nazil oldu. Ayənin mənası belədir:) **yer üzündə** (hərəkət edən) **o qədər canlı var ki, öz ruzilərini daşıya** (əldə edə) **bilmirlər,** (اَللّٰهُ يَرْزُقُهَا وَاِيَّاكُمْ وَهُوَ السَّمِيعُ الْعَلِيمُ) – **onlara da, sizə də ruzi verən Allah-Təaladır və** (sizin - qərib vilayətdə necə dolanacağıq? – sözünüzü və qəlbinizdəkiləri) **Allah-Təala eşidib biləndir,** (bunu nifaq səbəbilə, yoxsa təmiz qəlblə dediyinizə agahdır)**.**

**61)** (وَلَئِنْ سَاَلْتَهُمْ مَنْ خَلَقَ السَّمٰوَاتِ وَالْاَرْضَ) - (ey Məhəmməd, əgər bu Məkkə əhlindən) **soruşsan ki, bəs səmaları və yeri yaradan kimdir?** (وَسَخَّرَ الشَّمْسَ وَالْقَمَرَ) - **və** (daim bir nizam içində hərəkət edən) **günəşi və ayı kim ram etmişdir?** (لَيَقُولُنَّ اللّٰهُ) - **əlbəttə, deyərlər ki,** (onları yaradıb ram edən) **Allah-Təaladır.** (فَاَنّٰى يُؤْفَكُونَ) - **bəs niyə** (bu Məkkə əhli Allahdan) **dönüb** (özgə məbudlara sitayiş edir?)

**62)** (اَللّٰهُ يَبْسُطُ الرِّزْقَ لِمَنْ يَشَٓاءُ مِنْ عِبَادِهٖ وَيَقْدِرُ لَهُ)- **Allah-Təala öz bəndələrindən istədiyinin ruzini artırar və istədiyini azaldar,** (heç kim də etiraz edə bilməz)**.** (اِنَّ اللّٰهَ بِكُلِّ شَيْءٍ عَلِيمٌ) - **həqiqətən, Allah-Təala hər bir şeyə agahdır.** (Bəndələrinin öz halına görə, onlara ruzi verir)**.**

**63)** (وَلَئِنْ سَاَلْتَهُمْ مَنْ نَزَّلَ مِنَ السَّمَٓاءِ مَٓاءً فَاَحْيَا بِهِ الْاَرْضَ مِنْ بَعْدِ مَوْتِهَا) - (ey Məhəmməd), **əgər** (bu müşriklərdən) **soruşsan ki, səmadan su göndərib** (o su səbəbi ilə)

لَيَقُولُنَّ اللّٰهُ قُلِ الْحَمْدُ لِلّٰهِ بَلْ اَكْثَرُهُمْ لَا يَعْقِلُونَ ﴿٦٣﴾ وَمَا هٰذِهِ الْحَيٰوةُ الدُّنْيَآ اِلَّا لَهْوٌ وَلَعِبٌ وَاِنَّ الدَّارَ الْاٰخِرَةَ لَهِيَ الْحَيَوَانُ لَوْ كَانُوا يَعْلَمُونَ ﴿٦٤﴾ فَاِذَا رَكِبُوا فِي الْفُلْكِ دَعَوُا اللّٰهَ مُخْلِصِينَ لَهُ الدِّينَ فَلَمَّا نَجّٰيهُمْ اِلَى الْبَرِّ اِذَا هُمْ يُشْرِكُونَ ﴿٦٥﴾ لِيَكْفُرُوا بِمَآ اٰتَيْنَاهُمْ وَلِيَتَمَتَّعُوا فَسَوْفَ يَعْلَمُونَ ﴿٦٦﴾ اَوَلَمْ يَرَوْا اَنَّا جَعَلْنَا حَرَمًا اٰمِنًا وَيُتَخَطَّفُ النَّاسُ مِنْ حَوْلِهِمْ اَفَبِالْبَاطِلِ يُؤْمِنُونَ

---

**ölümünün arxasınca yeri dirildib** (hər cür ot-ələfi və gülləri yetişdirən) **kimdir?** (لَيَقُولُنَّ اللّٰهُ) **- əlbəttə, deyəcəklər: “Allah-Təaladır.”** (قُلِ الْحَمْدُ لِلّٰهِ بَلْ اَكْثَرُهُمْ لَا يَعْقِلُونَ)- (ey Məhəmməd, elə ki müşriklər hər bir nemətin Allah-Təaladan olduğunu iqrar etdilər, o vaxt) **de ki, Allah-Təalaya həmd-səna edirəm,** (bu müşriklər öz dediklərini) **anlamırlar.** (İqrar edəndən sonra da Allah-Təalaya şərik qoşurlar, əgər anlasalar, şərik qoşmazdılar)**.**

**64)** (وَمَا هٰذِهِ الْحَيٰوةُ الدُّنْيَا اِلَّا لَهْوٌ وَلَعِبٌ) **- bu dünya həyatı** (sürətlə məhv olub gedən uşaq) **əyləncəsindən başqa bir şey deyil.** (Necə ki uşaqlar cəm olub, bir oyun oynayıb sonra dağılıb gedirlər, dünya həyatı da belədir, tez bir zamanda fani olar. Aqil odur ki, dünyaya aldanmayıb, beş günlük ömrünü qəflətdə keçirməsin. Vətən övladlarına əlindən gəldiyi qədər yaxşılıq edib, özündən ötrü tarixdə gözəl ad qoysun)**.** (وَاِنَّ الدَّارَ الْاٰخِرَةَ لَهِيَ الْحَيَوَانُ لَوْ كَانُوا يَعْلَمُونَ) **- həqiqətən, axirət evi əbədidir,** (orda heç vaxt ölüm olmaz. Kaş kafir və müşriklər bu mətləbə agah olub dünyanı axirətə üstün tutmasınlar)**.**

**65)** (فَاِذَا رَكِبُوا فِي الْفُلْكِ دَعَوُا اللّٰهَ مُخْلِصِينَ لَهُ الدِّينَ) – (bu müşriklər şirk və inadlarında möhkəmdirlər. O cümlədən inadlarından biri də budur: dəniz səfərinə çıxmaq üçün) **gəmiyə mindiklərində,** (dənizdə qərq olma qorxusundan) **dini ancaq Allah-Təalaya məxsus edib** (möminlər kimi) **ixlasla dua edərlər,** (sanki, heç müşrik deyillər)**.** (فَلَمَّا نَجّٰيهُمْ اِلَى الْبَرِّ اِذَا هُمْ يُشْرِكُونَ) **-** (Allah-Təala) **onlara** (dəniz təhlükəsindən) **nicat verib** (sağ-salamat) **quruya çıxartdıqda isə,** (qəfildən görərsən ki,) **yenə** (şirkə dönüb Allah-Təalaya) **şərik qoşurlar.**

**66)** (لِيَكْفُرُوا بِمَا اٰتَيْنَاهُمْ وَلِيَتَمَتَّعُوا) **-** (onlara nicat verməyin əvəzində, gərək, Allah-Təalaya şükür edib ixlasla ibadət edəydilər)**, amma onlar nicat tapdılar ki, onlara bəxş etdiyimiz** (bu qurtuluş nemətinə) **nankorluq edib** (dünyadan) **ləzzət alsınlar?** (فَسَوْفَ يَعْلَمُونَ) **– tezliklə** (öz axirətdəki aqibətlərinə) **agah olub** (peşman olacaqlar)**.**

**67)** (اَوَلَمْ يَرَوْا اَنَّا جَعَلْنَا حَرَمًا اٰمِنًا) **– bəs** (Məkkə əhli Allah-Təalanın bu nemətinə şükür edib) **onlardan ötrü** (Məkkəni) **necə hörmətli və əmin bir yer etdiyimizi görmürlər?** (وَيُتَخَطَّفُ النَّاسُ مِنْ حَوْلِهِمْ) – (onlar Kəbənin səbəbinə Məkkədə rahat və asudə oturublar)**. Amma onların ətrafındakı insanlar** (Məkkədən kənarda) **qamarlanıb götürülür** (qətl və qarət edilir)**.** (اَفَبِالْبَاطِلِ يُؤْمِنُونَ) **– bəs**

**وَبِنِعْمَةِ اللّٰهِ يَكْفُرُونَ ﴿٦٧﴾ وَمَنْ اَظْلَمُ مِمَّنِ افْتَرٰى عَلَى اللّٰهِ كَذِبًا اَوْ كَذَّبَ بِالْحَقِّ لَمَّا جَآءَهُ اَلَيْسَ فِي جَهَنَّمَ مَثْوًى لِلْكَافِرِينَ ﴿٦٨﴾ وَالَّذِينَ جَاهَدُوا فِينَا لَنَهْدِيَنَّهُمْ سُبُلَنَاۜ وَاِنَّ اللّٰهَ لَمَعَ الْمُحْسِنِينَ ﴿٦٩﴾**

---

(Məkkə əhli bununla belə yenə) **batil bütlərə iman gətirir?** (وَبِنِعْمَةِ اللّٰهِ يَكْفُرُونَ) **– və Allah-Təalanın nemətlərinə nankorluq edirlər?**

**68)** (وَمَنْ اَظْلَمُ مِمَّنِ افْتَرٰى عَلَى اللّٰهِ كَذِبًا) **- Allah-Təalaya yalandan iftira edib,** (O, özünə şəriklər qoşub – deyəndən) **daha zalım olan kimdir?** (Necə ki Məkkə əhli deyirdilər ki, Allah bu bütləri özünə şərik qoşubdur). (اَوْ كَذَّبَ بِالْحَقِّ لَمَّا جَآءَهُ) **- yenə özünə haqq** (peyğəmbər və Quran) **gəldiyi halda, onu təkzib edib** (iman gətirməyəndən daha zalım olan kimdir?) (اَلَيْسَ فِي جَهَنَّمَ مَثْوًى لِلْكَافِرِينَ) **– bəs** (Allah-Təalaya iftira edib haqqı təkzib edən) **kafirlərdən ötrü cəhənnəmdə bir məkan yoxdur?** (Əlbəttə, onların gələcək məkanları əbədi olaraq cəhənnəmdədir).

**69)** (وَالَّذِينَ جَاهَدُوا فِينَا لَنَهْدِيَنَّهُمْ سُبُلَنَا) **- o şəxslər ki, bizim yolumuzda cihad edir,** (yəni ibadət edib, nəfsə qarşı cihad etməklə Allaha yaxınlaşır və ya din düşmənləri ilə cihad edib islamı ucaldır, ya da malla cihad edib islamı yayır), **onları öz yolumuza hidayət edib,** (etdikləri əməllərdə yardım və bərqərar edərik). (وَاِنَّ اللّٰهَ لَمَعَ الْمُحْسِنِينَ) **- həqiqətən, Allah-Təala yaxşı əməl sahibləri ilə bir olub** (onları müvəffəq edəndir).

Allaha həmd olsun, Ənkəbut surəsinin təfsiri bitdi, Hz. Peyğəmbər buyurubdur: "Ənkəbut surəsini kim oxusa, Allah-Təala ona 10 savab bəxş edər." İnsana dərk edən qəlb, açıq göz, eşidən qulaq lazımdır ki, bu mübarək surədə zikr olunan hikmətləri, nəsihətləri yadda saxlayıb, özünə rəhbər etsin. Belə ki, onların nuru ilə cəhalət qaranlığından nicat tapıb elm nuru ilə aydınlansın. Qurani-Şərifin ayələrini başdan-sona kimi bəsirət gözüylə təfəkkür edənlər bu mətləbi dərk edə bilərlər ki, Qurani-Şərifin məqsədi insanları elmə dəvət edib zəlalət vadisindən qurtarıb, cəhalətdən nicat verməkdir. Çünki insanı hər bir xəbis əməllərdən mühafizə edib insaniyyət, insaf və mürüvvət sahibi edən şey ancaq elmdir. "Nəfsini bilən rəbbini bilər", -hədisində deyildiyi kimi, Allah-Təalanı tanımağın yolu insanın öz nəfsini tanıması ilə mümkündür. Nəfsi tanımaq üçün də elm təhsil etmək lazımdır. Din elmi, maarifçilik, tibb elmi, riyaziyyat, coğrafiya, həndəsə və s. bu kimi elmləri öyrənən şəxs elmdə kamilləşəndən sonra yenə də diqqət edib, özünü çox şeylərdə naqis görüb özündən üstün başqa bir alimin var olduğunu düşünər. "Hər elm sahibindən daha üstün bir alim var", -şərtinə görə, kim özünü naqis görüb, özündən də üstün bir alim olduğunu düşünsə, özü də kamilləşəcək, bütün alimlərin qüsursuz elm sahibi olan yeganə yaradıcının yanında naqis olub, məhz aləmlərin Xaliqinin müqəddəs varlığına şəhadət edib, Onun bütün aləmləri yoxdan yaratdığını iqrar edib deyəcək ki,

həqiqi alim olan ancaq O müqəddəs zatdır. Ona həmd-səna edib, son dərəcə zillətlə qulluğumu Ona ərz edirəm. Allaha həmd olsun, “Kəşfül-Həqaiq” adlı təfsirin ikinci cildi cümə axşamı, rəbiül-əvvəl ayının 10-cu günündə h. 1322-ci ildə bitdi. Bundan sonra Rum surəsi başda olmaqla 3-cü cild gələcək. Allahım, onu bitirməkdə bizi müvəffəq et!

## MÜNDƏRİCAT



İpəkyolu Nəşriyyatı: 131

*Bu kitab Azərbaycan Respublikası Dini Qurumlarla İş üzrə Dövlət Komitəsinin*
***3 iyul 2013-cü il DK-285/R** nömrəli razılıq məktubuna əsasən nəşr edilmişdir.*

Şərq-Qərb Mətbəsi

Bakı Şəhəri Aşıq Ələsgər küçəsi 17
Tel: (+994 12) 370 32 22
Faks: (+994 12) 370 18 49
Web sayt: www.eastwest.az/
Elektron poçt: ofis@eastwest.az